# Kəşfül-Həqayiq

an-Nukətil-Ayati vəd-Dəqaiq

(Ayələrin Məna və İncəlikləriylə Həqiqətlərinin Açıqlanması)

Azərbaycan türkcəsində Qurani-Şərifin təfsiri

## I cild

**Müəllif və naşiri:**

Hacı Mirməhəmməd Kərim Mircəfər əl-Ələvi əl-Hüseyni əl-Musəvi əl-Bakuvi

Bakı şəhərinin qazısı və quberniya məclisinin sədri

15 şaban 1322-ci il

7 yanvar 1904-cü ildə Tiflisdə senzura icazəsi ilə
“Kaspi” qəzetinin Buxariyyə mətbəəsində çap olunub.

# TƏQDİMAT

Azərbaycan xalqının idealogiyasının və mənəviyyat fəlsəfəsinin təşəkkülündə din alimlərinin maarifçilik cərəyanı xüsusi yer tutur. Azərbaycan mənəvi-mədəni dəyərlər bazası məhz onların düşüncə və səyləri ilə formalaşmışdır. Milli dəyərlər və mənəvi ənənələrin birləşdirilməsi sayəsində təşəkkül tapan bu məfkurə universallığı ilə fərqlənən bir irsə çevrilmişdir.

XIX əsrdə ölkənin idealogiyasında maarifçilik fəlsəfəsinin artması ictimai böhrandan çıxış yolunun xalqın maariflənməsində görülməsinə təkan verdi. Bu dövrdə etnik varlığın qorunub saxlanması da əhəmiyyət kəsb edən bir amil olduğu üçün onun tərkib hissəsi olan dinin vəziyyəti  maraq doğururdu. Xalqın dini maariflənməyə olan ehtiyacı və maarifçi ideolqların dinə münasibətdə müxtəlif mövqedə olduğu bir şəraitdə bunun öhdəsindən gəlmək özlüyündə məsuliyyət tələb edən bir hala çevrilmişdi. Belə bir müəmmada, Quran həqiqətlərinin sadə bir dildə xalqa çatdırılması, onun fövqəlbəşər ecazının əks etdirilməsi, eyni zamanda maarif və inkişafın həm də bir Quran qayəsi olduğunu göstərmək vacib məsələ  idi.

Elmi dünyagörüşünün formalaşmasında ensiklopedik biliyə malik, şəxsi elmi axtarışları, təmsil etdiyi Azərbaycan və Şərq mədəniyyəti ictimai fikri və fəlsəfi ənənələri ilə tanışlığı mühüm rol oynayan bir ziyalı kimi Mir Məhəmməd Kərim Bakuvi (1858-1939) bu dövrə işıq tutacaq bir əsər nümayiş etdirdi.  Bakuvi, Qurani-Kərimə yazdığı üç cildlik təfsiri ***"Kəşfül-Həqayiq an Nukətil-Ayəti vəd-Dəqayiq"*** əsəri ilə Azərbaycan müsəlmanlarının öz dilində dini maariflənmə üçün mədəni inqilab səviyyəsində bir fəaliyyətə imza atdı.

Söz yox ki, XX əsrə qədər Azərbaycan dilində yazılmış təfsir əsərlərinə rast gəlməsək də, Azərbaycan alimləri tərəfindən ya-

zılmış ərəbcə təfsirlərə rast gəlmək mümkündür. Ağa Nemətullah Naxçıvani hələ XV əsrdə *"Fəvatihul-İlahiyyə vəl-Məfatihul-Ğaybiyyə"* adlı təfsir yazmışdır. Bundan başqa İran, Osmanlı və s. kimi müxtəlif ölkələrdə yaşayıb-yaradan alimlərimiz olmuşdur. Hərçənd Quranın Azərbaycan dilinə ilk tərcüməsinin Uzun Həsənin əmrilə edildiyi də bizə məlumdur. Ancaq bu tərcümə geniş xalq kütlələrinə mal olmamış, eyni zamanda Azərbaycanda Quranı qaynağından öyrənmək imkanı ancaq ərəbcə mükəmməl bilənlərlə məhdud qalmışdır.

Bu səbəblədir ki, Bakuvinin ***"Kəşfül-Həqayiq"***i, dövrün nöqsanları və ehtiyacları əsasında qələmə alınmış bir təfsir olaraq hər təbəqədən insanlara müraciət edən əsər kimi işıq üzü gördü.

Qeyd etmək lazımdır ki, belə bir şəxsiyyətin dünyagörüşü və islami fikirləri Quranın tərcümə və təfsirinə əsaslanan bu əsərində lazımi səviyyədə əks etdirilərək ictimaiyyətə çatdırılmışdır. Onun bəzi Quran ayələrinə gətirdiyi sırf özünəməxsus izahları, ümumbəşəri problemlərin həllinə dair fikirləri, məzhəb anlaşmazlıqlarının səbəbləri və çıxış yolları kimi birlik və vəhdət çağrıları həm də müasir dövrün tələbidir.

Bu baxımdan Bakuvi təfsirinin müasir əlifba ilə yeni nəşri, tarixi və milli-mənəvi dəyərlər mənzuməsindən bir əsər olması cəhəti ilə tozlu rəflərindən götürülərək yeni nəslin idrakına təqdim edilməyə layiq ən görkəmli əsərdir.

**Professor Şeyxülislam A. H. Paşazadə**

Qafqaz Müsəlmanları İdarəsinin
sədri

## MƏHƏMMƏD KƏRİM BAKUVİNİN HƏYATI

Mir Məhəmməd Kərim Mircəfərzadə Bakuvi, 1858-ci ildə Bakıda məşhur seyid nəslindən olan Hacı Mircəfər ağa Seyid Məhəmməd oğlunun ailəsində dünyaya gəlmişdir. Onun soy şəcərəsi Əli ibn Əbu Talibə qədər gedib çıxır. Bakuvinin anası Nərgiz xatun şeyx Nəcəfin qızı idi. Bakuvinin babası isə İçərişəhər məscidinin axundu Ağa Seyid Məhəmməd idi.

İlk təhsilini atasından və İçərişəhərdəki mədrəsədə alan Bakuvi, ali təhsilini atası Mircəfərin arzusu ilə 1871-1881-ci illərdə Bağdadda almışdır. Ərəb dilini, fiqh, kəlam, təfsir, islam tarixi kimi elmləri dərindən öyrəndikdən sonra Bakıya dönmüş, imtahan verərək 1894-cü ildə prixod mollası adını, 1895-ci ildə axund adını almış, səkkiz il Bakıda Gilək məscidində və İçərişəhərdəki Şah məscidində fəaliyyət göstərmişdir. Mir Məhəmməd Kərim 1904-cü ildə Bakı qəzasının qazısı və Bakı quberniyası Şiə Məclisinin sədri vəzifələrinə seçilmiş, 1918-ci ilə kimi bu vəzifələrinə davam etmişdi.

Maddi- mənəvi, fərdi və ictimai işlərdə onun məsləhətinə üz tutanların sayı hesabı yox idi. O, nəzəri maarifçilik işi ilə yanaşı ictimai sahələrdə də fəal maarifçilik işi görürdü. Onun ilk sədri olduğu "Hidayət" xeyriyyə cəmiyyəti bu sahədə ilk ictimai təşkilat olub bu sahədə geniş fəaliyyət aparırdı.

Mir Məhəmməd Kərim, təşkilatçılığı və İslamın dövrün ehtiyaclarına olan töhfələrini səsləndirməklə həmişə diqqəti cəlb edən bir mövqedən çıxış edirdi. Onun yenilikçi ruhu cəmiyyətin bir çox ilklərinə də səbəb olmuşdur.

Bakuvi əsrinin elmi nailiyyətlərindən çıxış edərək mənəvi təkmilləşmədə elmə, elmlə əməlin (praktikanın) bağlılığına xüsusi əhəmiyyət verirdi. Moizə və söhbətlərində elmin inkişaf

yolları və savadsızlığın aradan qaldırılması onun əsas meyarı olmuşdu. O deyirdi: "*Dinin və imanın əsası elm və irfandır. Balalarınızı məktəbə göndərin. Milli yüksəlişin yeganə yolu elmdən keçir.*"

O, milli münaqişələrin yatırılmasında, sülh proseslərində də fəal iştirak edirdi. 1905-ci ildə Bakıdakı erməni daşnaklarının törətdikləri faciələrdə qırğını dayandırmaq üçün öz canını fəda edərək aktiv təşəbbüs göstərmiş və belə demişdi: "*Cənablar, nə üçün yubanırsınız? İtirdiyimiz hər dəqiqə onlarla bədbəxtin həyatına bais ola bilər. Mən əlimdə Quran qabaqda gedəcəyəm. Qoy birinci güllə mənə dəysin*". Sükunətin bərpasından sonra ermənilər yazırdı ki: "*Müsəlmanları öldürmək üçün əvvəlcə Qazını öldürmək lazım idi.*"

O, həmçinin 1918-ci ilin mayında qurulan iki illik Azərbaycan Demokratik Cumhuriyyətinin ən hərarətli tərəfdarları arasında milli azadlıq və milli birliyin carçısına çevrilmişdi.

İctimai görüşlərində kamil insan və təkmil cəmiyyət konsepsiyasından çıxış edən Bakuvi sübut etməyə çalışırdı ki, müsəlman aləminin inkişaf maneələri arasında ən böyük amil müqəddəs Quranın göstərdiyi yoldan uzaq qalmaqdan qaynaqlanır.

O, hələ yüz il əvvəl insanlara demokratiya dərsi verir, yazdığı təfsirində Hücurat surəsinin ikinci ayəsi ilə buna geniş izah gətirirdi. Ona görə, inanan və inanmayan hər kəs Qurandan bəhrələnir. Quran müşavirəni, əksəriyyətin qərarına hörmətamiz davranmağı və həmfikir olmağı əmr edir. Müsəlmanlar bunu izləməsə də dünyanın bütün qabaqcıl ölkələri bu prinsiplərlə idarə edilir. Əsas demokratiyanın özü İslamdadır. Ona görə belə möhtəşəm bir qaynaq əldə mövcud ikən bunun sadəcə ölülərə aid edilməsi qəbul edilə bilməz.

Bakuvi xeyriyyəçilik tədbirlərində də yaxından iştirak edirdi. Məsələn, Musa Nağıyevin oğlu Ağa İsmayıl öləndən sonra Novruz bayramında Hacı bir neçə məşhur axund, qazı və ağsaqqal, o cümlədən Mir Məhəmməd Kərim, Axund Mirzə Əbu Turabla məsləhətləşib qərara gəlirlər ki, Ağa Musa gələndə cəmiyyəti-xeyriyyə üçün bina tikdirməyi onun boynuna qoysunlar.

1917-ci il fevralın 18-də, Bakı xanının qardaşı Hüseynqulu xan general Sisiyanovun başını qılıncla üzdüyü yerdə, «Naxır bulağı»nın üstündəki «Şollar-Bakı» su kəmərinin ilk su vermə

mərasimində qazı Mir Məhəmməd Kərim əlində Quran sözə başlamış, Qurandan ayələr oxuyaraq həyatın əsasının su olduğunu demiş, imperator ailəsinə dua edərək əhalini su kəmərinin başa çatması münasibətilə təbrik etmiş, bu yolda xərc və zəhmət çəkənlərin ata-analarına dua oxumuş, özlərinə cansağlığı və var-dövlət arzu etmişdi. Hacı Zeynalabdin Tağıyevin xidmətlərini xüsusi qeyd edən Bakuvi Hacıya kranı birinci açmağı təklif etmişdi.

Çox təəssüf ki, "Molla Nəsrəddin" jurnalı Bakuvi kimi mütəfəkkir din alimlərini də təhqir edir, onların karikaturalarını öz səhifələrində dərc edirdi. "Molla Nəsrəddin", "Kəşfül-Həqayiq" kitabının naşiri olan H. Z. Tağıyevi də belə bir əsəri nəşr etdirdiyinə görə qınayırdı. (Bax: "Molla Nəsrəddin", 9 dekabr 1907, №46 ; 16 aprel 1911, № 14; 10 iyul 1911, №25.)

1920-ci ildə Qafqazda siyasi vəziyyətin dəyişməsi ilə Mir Məhəmməd Kərim Mərdəkandakı evinə çəkilərək elmlə məşğul olmağa başladı. Çünki Azərbaycanı işğal edən Qzıl Ordu milli-mənəvi dəyərləri qadağan etmiş, bunun nəticəsində 1925-ci ildə "*Allahsızlar cəmiyyəti*" qurmuş, eyni zamanda dini və dindarları sosialist düşməni kimi qələmə vermişdilər. Bu siyasətin "təmizləmə hərəkatı" nəticəsində Qazı Məhəmməd Kərim də müxtəlif bəhanələrlə dindirilməyə başlandı. Əməliyyat müvəkkili Varoşkeviç onu 13 fevral 1938-ci ildə Məştağa şöbəsində sorğuya çəkdi. Yalançı şahidlər dinləndi və eyni gün məhkəmə qərarı üzünə oxundu.

Mir Cəfər oğlu Məhəmməd Kərim 1939-cu il martın 15-dən 16-na keçən gecə represiya qurbanları arasında güllələnərək şəhid edildi. Dini fəaliyyəti və anti-sovet çıxışları ilə rejim əleyhdarı elan edilən alimin evi talan edilmiş, kitabxanası isə yandırılmışdı. İslam ümmətinə ondan qalan xatirə isə xalqımıza onun ən böyük töhfəsi sayılan "**Kəşfül-Həqayiq"** təfsir ilə çap edilmiş aşağıdakı yazıları və tərcümələri qaldı.

1) "İran kəndlərinin halı", 2) "Təbrizdə gördüklərim", 3) "On yeddi Ramazan", 4) "Ermənüsə", 5) "Özreyi-Qureyş", 6) "Kərbəla yanğısı", 7) "Fətətu Ğassan", 8) "Rəşidin bacısı Abbasə", 9) "Əbu Müslüm əl-Xorasani", 10) "Səlib müharibəsi", 11) "Emin və Məmun qardaşlar".

# TƏFSİR HAQQINDA

Quran elmləri arasında təfsir, ən geniş sahədir. İlahi kəlamın izah və açıqlanması Həzrət Peyğəmbərdən (s.ə.s) başlayaraq bu günə qədər davam etmişdir. Bu məqsədlə Quran tarixinə külli miqdarda ədəbiyyat daxil olmuşdur. Təbii olaraq, yazılan bu təfsirlərin əksəriyyəti ərəb dilində, bir qismi isə osmanlıca və fars dilində yazılmışdı.

Ərəb dilində təfsirlərin başa düşülməsinin çətinliyi səbəbilə müsəlmanların öz dilində oxuyub anlayacaq sadə bir təfsirə ehtiyac var idi. Məhəmməd Kərim Bakuvi belə bir əsər qələmə alaraq, azərbaycan türkcəsində ilk təfsiri ərsəyə gətirdi.

Təfsirin "*Kəşfül-Həqayiq an Nukətil-Ayəti vəd-Dəqayiq / Ayələr və keyfiyyətlərinin incəlikləri haqqında həqiqətlərin kəşfi*" adından da görüldüyü kimi əsas məqsəd xalqın Quranın izah və hökmlərinə diqqətlə baxıb görməsini təmin etmək, Quranın mənasının asan anlaşılması və uca qayəsindən həzz alınmasına xidmət etmək idi.

Hər təfsirin özünə xas metod və xüsusiyyətləri vardır. Məhəmməd Kərim Bakuvinin bu əsəri, təfsir üsulu baxımından zəngin möhtəvaya sahib bir əsərdir. Bu baxımdan rəvayət təfsiri yönündən əsərin metodu haqda aşağıdakıları sadalamaq olar;

Müəllif, ayələrin nazil olma səbəbləri və hikmətləri baxımından tarixi hadisələrə aid rəvayətlərə geniş toxunaraq, zəif rəvayətləri rədd edir, bəzi müfəssirləri tənqid edir, ehtiyac olmayan izahlardan uzaq durmağa çalışırdı.

Quranın Quranla təfsiri müfəssirlərin əksəriyyəti tərəfindən istifadə edilmiş bir metoddur. Quranın bir yerindəki ayənin izahı və anlaşılması üçün başqa bir yerdə keçən ayə vardırsa və ya bir yerdəki mövzu başqa bir yerdə daha geniş əks etdirilmişdirsə

bu ayələri yanaşı təfsir etmək və biri ilə digərini aydınlaşdırmaq təfsir eimində ən məqsədəuyğun yol hesab edilmişdir.

Bakuvi də bu metoda böyük əhəmiyyət vermiş, bir ayəni daha açıq başqa bir ayə ilə, eyni zamanda bir ayəni başqa bir ayə ilə ancaq ləfzi yox yalnız mənası ilə təfsir etmişdir.

Quranın sünnə ilə təfsirində ayələrin Həzrət Peyğəmbər əleyhissalamın sünnəsi möhtəvasında izahı geniş yer tutur. Müfəssir təfsirdə müxtəlif hədis qaynaqlarından, bəzən öz məzhəbi olan əhli-şiənin "*mutunu-ərbəə*" adlanan dörd hədis kitabından, bəzən də əhli-sünnə hədis qaynaqlarından təfərrüatı ilə istifadə etmişdir.

Əsabələr və tabeundan gələn rəvayətlərə ehtiyacı qədər müraciət etmiş, ayələrin təfsir və izahlarında onların rəyi və rəvayətlərindən istifadə etmişdir. Onlardan ən çox müraciət edilənlər arasında Abdullah ibn Abbas, Həsən Bəsri, Həzrət Əli, Həzrət Cəfər Sadiq, Abdullah ibn Məsud, Mücahid, Qatadə və Süfyan ibn Üyeynəni sadalamaq olar.

Onu da qeyd etmək lazımdır ki, təfsirdə iki mövzu xaricində İsrailiyyətə rastlamaq mümkün deyildir.

Dirayət təfsiri yönündən isə əsərin metodu haqda aşağıdakıları sadalamaq olar;

Digər bir adı ilə "*rəy*" təfsiri adlanan bu metodda, ilahi kəlamın mənşəyi və işlənmə dairəsi baxımından leksikası, sözlərin həqiqəti və məcazı, morfolojik və sintaktik cəhəti, arxaizmlərin incə təhlili, Bakuvinin sərf, nəhv və bəlağat elmindəki dərin pedaqoji biliyi möhtəvasında əks etdirilmişdir.

Əhkam ayələrinin hökmlərə dəlaləti və istinbat dəyəri, onların nasix və mənsuxu, üsulid-din adlanan elmi-kəlam mövzularının təsviri, qiraət elimi və Quran tarixi təfsirin sistematik təhlil qaydaları arasında öz yerini qorumuşdur.

Müəllif, bəzi hallarda mövzuları müasir müstəvidə təhlil etmişdir. Vətən sevgisi, ictimai-siyasi idarənin insan üçün əhəmiyyəti, planetlərin ömrü məsələsində və isbat edilmiş elmi tədqiqatların Qurana ziddiyətinin mümkünsüzlüyü kimi mövzulara müasir prizmadan baxmışdır.

*Təfsir Haqqında*

Elmin hər sahəsində olduğu kimi bu əsərdə də bir çox yeniliklər keçmiş biliklərin təməlləri əsasında qoyulmuşdur. "**Kəşfül-Həqayiq**" təfsiri də özlüyündə Quran təfsirləri arasında bu sahənin mötəbər qaynaqlarına istinad etmişdir. Zəməxşərinin (v. 1143) "*Təfsiri-Kəşşaf*", Təbərsinin (v.1153) "*Məcməul-Bəyan*", Fəxrəddin-Razinin (v.1209) "*Təfsiri-Kəbir*", Əbus-Süud Əfəndinin (1574) "*İrşadul-Əqlis-Səlim*", Əbu Məhəmməd Bəğavinin (v.1341) "Lübabüt-təvil fi məanit-tənzil" əsasında "əl-*Xəzin Təfsiri*", Nəsəfinin (ö.1310) "*Mədariküt-Tənzil və Həqaiqü-t-Təvil*", Qazi əl-Bəyzavinin (v.1286) "*Ənvarüt-Tənzil*", İsmayıl Haqqı Bursəvinin (v.1724) "*Ruhül-Bəyan*" kimi təfsirlərindən istifadə edilmişdir.

Mir Məhəmməd Kərimin hədis qaynaqlarından istifadəsinə gəlincə Bakuvi yuxarıda da qeyd edildiyi kimi həm Əhli-Sünnə, həm də İmamiyyə hədis ədəbiyyatından geniş istifadə edərək müdafiə etdiyi "*İslam millәti*" vəhdət məfkurəsinin nümunəvi timsalını özü təzahür etdirmiş, metodologiyasında əyani surətdə bunun mümkünlüyünü göstərmişdir. **Buxari**dən **Kuleyni**yə qədər bütün hədis qaynaqlarına müraciət etmişdir.

Təfsirin digər klassik təfsirlərdən fərqləndirən spesifik xüsusiyyətləri də vardır. Bunlardan bəziləri belədir; Müəllifin "Furqan" surəsinin 39-cu ayəsində bəhs edilən "Rəss camaatı"nın Qafqazda, Araz çayı ətrafında yaşayan əhaliyə işarə etdiyini və Allahın onlara İsa ilə Məhəmməd peyğəmbər arasında Hanzala ibn Safvan adlı peyğəmbər göndərdiyini qeyd etməsidir (Kəşfül-Həqayiq, II/640). Yenə Bakuvi, "Bəqərə" surəsinin 102-ci ayəsində xalqa sehr öyrətdiyi qeyd edilən Harut və Marut adlı iki şəxsin mələk olduqlarını iddia etmənin doğru olmadığını, onların sehr elmini bilən iki padşah olduqlarını və xalqı imtahan etmək üçün onlara sehr elmini öyrətdiklərini qeyd edirdi (Kəşfül-Həqayiq, I/62).

Bakuvi Quranda adları çəkilən cin, şeytan, mələk kimi ruhani varlıqları da əqli, simvolik yollarla izah edir, onların bir çox yerdə insanlara işarə etdiyini, eyni zamanda Quranın bədəvi ərəblərə onların öz adət etdiyi misallarla xitab etdiyini qeyd edirdi (Kəşfül-Həqayiq, I/186-7). Məqamu-Mahmudun Məkkənin fəthi ilə bağlı mənası kimi bir çox təfsir və açıqlamalar onun özünəməxsus izah tərzi olduğunu göstərir.

Bununla yanaşı müfəssir alim, öz təfsiri ilə XX əsrin astanasında müsəlman ictimaiyyətinin yaralarını sarmağa, mənəvi böhrana yol açan təfriqə, nifaq, cəhalət və xürafatın qarşısını almağa, müsəlmanları Quran həqiqətləri ətrafında sıx birləşməyə çağırırdı.

Bu minvalla ərsəyə gələn əsər 1904-cü ildə Hacı Zeynəlabidin Tağıyevin maddi vəsaiti ilə Tiflisdə "Kaspi" qəzetinin Buxariyyə mətbəəsində çap olundu.

İlk dəfə türk dilində, Azərbaycan türkcəsində nəşr olunan təfsirin şanı və şöhrəti bütün Türkistana yayıldı. Əsərinin nəşri islam aləmində böyük əks-səda yaratmış, müəllifə böyük şöhrət qazandırmışdı. Müəllifə Türkmənistandan, Tatarıstandan, Gürcüstandan bir çox hədiyyələr, Özbəkistandan xələtlər, İrandan "Şiri-xurşid" medalı, Osmanlı dövlətindən isə ağ platindən 8 guşəli medal təqdim olunmuşdu. Təfsirin üç nüsxəsi 1907-ci ildə İstanbula göndərilmiş, Osmanlı padişahı II Abdulhəmidə Axund Yusif Talıbzadə tərəfindən şəxsən təqdim edilmişdir ki, bu haqda yazı sənədi hal-hazırda Başbakanlıq arxivi Osmanlı ilə Azərbaycan Xanlıqları münasibıtlırinə dair arxiv sənədləri arasında (II/216-220 №76) saxlanılır.

İsmayıl bəy Qasprinski də "Tərcüman" qəzetinin 24 sentyabr 1904-cü il nömrəsində Bakuvi haqqında belə yazırdı: "Axund Mir Məhəmməd Kərim Əfəndi fikri açıq, elm və məlumatı bol bir zatdır. Ülumi-diniyyədə olan yədi-tula (geniş bilik), azərbaycan şiveyi-türkisində yazdığı təfsir müsbətdir".

## ÖN SÖZ

Allaha həmd olsun, həbibi və rəsulu Məhəmməd Mustafaya, onun alinə, əshabına və Əhli-Beytinə salam olsun!

Çoxəsrlik və zəngin ənənəyə malik Azərbaycan xalqının dini ədəbiyyatında Qurani-Kərim elmlərinə həsr olunmuş əsərlər ən yüksəkdə durur. Çünki **"Sizin ən xeyirliniz, Quranı öyrənən və onu öyrədəndir"** hədisi-şərifi bir düstur kimi, hər bir mömini onun qulluğunda durmağa vadar etmiş, qəlblərin onun elm, hikmət və səadət nuru ilə payidar olması, ən müqəddəs borc hesab edilmişdir. Məhz bu amal müqəddəs Quranı təkcə oxumaq, öyrətmək yox, həm də onun həqiqətlərini izah və təfsir etməyə, sirlərini aydınlaşdırmağa xidmət etmişdir. Bu səpkidə meydana gələn cildlərlə əsərlərdən biri də, Mir Məhəmməd Kərim Bakuvinin (1858-1939) *"Kəşfül-Həqayiq an Nukətil-Ayəti vəd-Dəqayiq"* təfsiridir. Mürəkkəbinin quruduğu vaxtdan yüz il keçsə də, insanımızın ona olan ehtiyacı onu yazan qələmin səbəb və dərdləri qədər böyükdür. Dahi şair Nizami Gəncəvi necə də gözəl tərənnüm edir:

*Yüz il sonra sorsan: Bəs o hardadır?*
*Hər beyti səslənər: Burda, burdadır.*

Oxuculara təqdim edilən bu əsər, bir baxıma tarixi keçmişi olan zəngin ənənəni yeni nəslin zehin dünyasına çatdırmaq, gələcəyin xoşbəxtlik yolunu keçmişin sarsılmaz təməllərindən bəhrələnərək qurmaqdır.

Qurani-Şərifin üç cildlik bu təfsir kitabı, köhnə əlifba adlanan ərəb hərflərindən dilimizin latın əlifbasına çevrilmiş, əslinə sadiq qalaraq müasir üslubda və üç cilddə dizayn edilmişdir.

Hər şeydən əvvəl qeyd etmək lazımdır ki, texniki baxımdan əsərin yenidən tərtibatı dövrün tələbləri əsasında ərsəyə gəlmiş-

dir. Oxucuların müasir istifadə qaydalarının beynəlxalq standartlar əsasında qurulduğu nəzərdən qaçmamış, surə adları, ayələrin sayı, onların sıra nömrələri və sair kimi xüsuslar buna əsasən uyğunlaşdırılmışdır.

"Bəsmələ" adı ilə məşhur olan "بِسْمِ اللهِ الرَّحْمنِ الرَّحِيمِ / Bismilləhirrahmənirrahim"in İslam alimləri arasında bu və ya digər amillər səbəbilə hər surənin ilk ayəsi olub-olmadığı mübahisəli məsələlərdən biridir. Məhəmməd Kərim Bakuvi "bəsmələ"ni hər surənin birinci ayəsi qəbul etsə də, indiki tərtibat əsasında ayələrin nömrələnməsi bəsmələdən sonra göstərilmişdir.

Bir qisim qısa ayələrin birləşdirilərək təfsir edilməsi və eyni zamanda bəzi mətbəə xətaları ayə sayılarının fərqli sayda olmasına gətirib çıxartmışdır. O dövrlər üçün spesifik olan belə fərqliliklər Quran ayələrinin ümimilikdə 6200, 6236, 6666 və sair kimi fərqli rəqəmlər və sayını meydana gətirmişdi. Bu səbəblədir ki, *"Kəşfül-Həqayiq"* təfsirində Bəqərə surəsi 282, Nisa surəsi 175 ayə, Maidə surəsi 123, Rad surəsi 45 ayə və sairdir. Müasir tərtibatda isə Bəqərə surəsi 286, Nisa surəsi 176, Maidə surəsi 120, Rad surəsi isə 43 ayədir.

Kitabın nəşrində bəzən ayələrin mətni, bəzən də məal qisminin qeyd edilməməsi halları mətbəə xətalarından qaynaqlandığı qənaətini doğurur. Əlyazması ilə qarşılaşdırmanın mümkünsüzlüyü səbəbilə bu kimi yerlər akademiklər Ziya Bünyadov və Vasim Məmmədəliyev in birlikdə hazırladıqları "*Qurani-Kərim Məalı*"dan müvafiq olaraq tamamlanmışdır.

I cild "Fatiha" surəsindən başlayaraq "Tövbə" surəsi, II cild "Yunus" surəsindən başlayaraq "Ənkəbut" surəsi, III cild isə "Rum" surəsindən başlayaraq "Nas" surəsinə qədər möhtəvanı əhatə edir.

Təfsir haqqında tədqiqatlardan bəhs edərkən işıq üzü görmüş yeganə bir əsər kimi onun Türkiyədə çapdan çıxmış "*Gerçeğin Doğuşu: Alevi Kuran Tefsiri*"ni göstərmək olar. Kitab, Ahmet Dolunay tərəfindən uyğunlaşdırılmış və "Merkuri Yayınları" nəşriyyatından 2000-ci ildə çapdan çıxmışdır. Bundan başqa, ölkəmizdə və xaricində hələ nəşr edilməmiş və davam edən bəzi tədqiqatların olduğunu da qeyd etmək mümükündür.

## *Ön Söz*

Əsərin yeni nəşri ilə cəmiyyətimiz dini maarifləndirmə sahəsində böyük uğur və müvəffəqiyyət qazanacağını ümid edirik. Əsası odur ki, belə əhəmiyyətli bir işdə, Bakuvi təfsiri kimi daxili ressuslarımızdan istifadə etmək bizi daha çox şad edəcəkdir. Bu səbəblə onun ərsəyə gəlməsində dəstəyi və əməyi keçən hər kəsə dərin minnətdarlığımızı bildiririk.

## Bismillahir-Rəhmanir-Rəhim
## MÜQƏDDİMƏ

Varlığı yaradan, həqiqi yaradıcı olan Allaha sonsuz həmd-səna olsun ki, insanları digər varlıqlar arasından sənət və bilik baxımından seçib, elmlərin müşküllərini həll etmələri üçün onlara hidayət edib, aləmdəki sənətkarlığın incəliklərini kəşf etmələrini tənzimləmişdir. Hər nə qədər zamanın dövranı ilə ecazkar və qəribə elmlər insanlar tərəfindən yaradılsa da, bunların hamısı yeganə yaradıcı olan Allahın elm və qüdrətinə dəlil və sübutdur.

Hidayət yolunu göstərənlərin ən fəzilətlisi, ən alimi və ən mükəmməlinin pak ruhuna, rəhməti və neməti sonsuz olan Allahdan salam olsun ki, hənif dini olan islamı təsis etmək səbəbi ilə aləmin cəhalətini elmə, zülməti isə nura çevirdi. Bununla, Hz. Məhəmməd ibn Abdullah ibn Əbdülmüttəlib ibn Hişam ibn Əbdimənaf ibn Qusayy ibn əl-Qüreyşini nəzərdə tuturam. Günəş və ayın doğuş və batması miqdarı qədər o cənabın müqəddəs ruhuna Allah-Təaladan əfv və rəhmət olsun. Yenə onun fəzilətli nəsli və xeyirli səhabələri göz açıb yumacaq qədər də ilahi rəhmətdən uzaq qalmasınlar.

İslam dininə bağlı olub, onun öyrənilməsi vacib olan hökmlərinə tabe olub, itaət edənlər üçün hər şeydən əhəmiyyətli və vacib olan şey Qurani-Şərifin uca mənalarını anlayıb, ondakı faydalardan mənfəət əldə etməkdir. Çünki Qurani-Şərif ən üstün əxlaqı əmr edən, vəhşilik və cəhaləti qadağan edəndir. Qurani-Şərifin əsası islam dini olduğuna görə, hər müsəlman kişi və qadın insanlıq xüsusiyyətləri baxımından kamilləşmək üçün ondakı hökmləri, Onun açıq-aşkar olan ayələrinin içində örtülü qalan incəlikləri və rəmzləri öyrənməlidir. Qurani-Şərifi özünə

rəhbər edən, onun nuru ilə hidayət tapan heç kimdən heç vaxt insaf və mürüvvətin ziddinə bir əməl meydana gəlməz.

Qurani-Şərif ərəb dilində olduğuna görə, başqa dildə danışan millətlər üçün onun ehkamını və incəliklərini anlamaq mümkün deyil. Madam ki, Qurani-Şərifin mənası ucadır, elə isə o, hər bir millətin dilinə tərcümə və təfsir edilməsə, ondan lazım olduğu qədər faydalana bilməzlər. Hərçənd fars, türk, hind və başqa dilli şəxslərin içində ərəb dilinə agah olan şəxslər həmişə olub və indi də var və onlar Quranın ehkamını xalqa anladırlar. Amma bu hökmləri bir alimdən dinləməklə şəxsin öz dilində olan təfsirdən Qurani-Şərifin incəlik və ehkamlarını oxuyub dərk etməsi arasında böyük fərq vardır. Ərəb dilində həddindən çox təfsir vardır və digər bəzi dillərdə də təfsirlər yazılıbsa da, onlardan mühüm bir fayda əldə edilmir. Məsələn, fars dilində bir neçə təfsir vardır ki, o təfsirlərdə Quranın kəlmələrinə xas qrammatika qaydalarını və bəzi kəlmələri izah etməkdən başqa, Qurani-Şərifin incəliklərindən heç bir şeyi qeyd etməyiblər. Əksinə, müsəlman millətlərinin içində təfriqəyə səbəb olan sözlərdən bəhs olunub. Halbuki Qurani-Şərif başqa millətlərlə müsəlmanlar arasında və bütün millətlərlə sülh, ədalət və insaf üzrə hərəkət etməyi əmr edir.

*Nə varsa, bizim əyri-üyrü qamətimizdəndir,*
*Yoxsa sənin hədiyyən heç kəsin boyuna qısa gəlməz.*

Özünü alim kimi göstərənlərin yazıları islam ümmətini başqa millətlərin nəzərində insafsız, zalım və fəsadçı kimi göstərib, hətta onlar islamın əsası zülm və fəsad üzərinə qurulub deyib, islama həqarətlə baxırlar. Allah mühafizə etsin, islamda bir qüsur yoxdur. Qüsur ümmətin mənsublarındadır, nəinki islamın əsasında.

Hərçənd türk dilində olan təfsirlərin bəzisində Qurani-Şərifin mətləbləri həqiqətən, olduğu kimi açıqlanıbdır, lakin o təfsirlər osmanlıca yazıldığına görə bizim Azərbaycan türkcəsində danışanlar onlardan faydalana bilmirlər.

Həmd olsun, bu dövrdə islam ümməti arasında elm və maarif günbəgün yayılmağa başlayıb, elm və sənət öyrənmədə fövqəladə bir cəhd hiss olunur. Ana dilləri olan türk dilində ki-

tabların nəşr edilməsi və sonsuz bir şövqlə onlara öz dillərində öyrədilməsi görülür. Türk dilində danışan müsəlmanların Qurani-Şərifin ehkamlarını, öyüd-nəsihətlərini mümkün olan qədər öz dillərində öyrənməsi fərzdir.

İslam aləminə edilən zahiri və batini ən böyük xidmət, türk dilində danışan müsəlmanlardan ötrü onların dilində sadə bir təfsir yazmaqdır ki, bu sayədə onlar Qurani-Şərifin mətləblərini asan şəkildə dərk edib, onun uca məzmunundan ləzzət alıb, həqiqi insanlıq xüsusiyyətlərinə sahib olsunlar. Bu səbəbdən mən həqir hacı Mirməhəmməd Kərim Mircəfər əl-Ələvi əl-Hüseyni əl-Musəvi əl-Bakuvi özümə vacib saydım ki, Azərbaycan türkcəsində bir təfsir yazım ki, islam xadimləri arasında bizim də kiçik bir xidmətimiz var olsun. Hərçənd Quran ayələrinin təfsirini türk dilində ifadə etmək çətin olduğuna görə, bəzi müşküllər görülür, buna baxmayaraq, bu çətinlikləri özümüzə asan hesab edib, bu nəcib işə başladıq.

Bu təfsirdə qeyd olunan mətləbləri aşağıda göstərilən mötəbər təfsirlərdən alıb, diqqətlə təhqiq edərək öz kiçik araşdırmalarımı da onlara əlavə etdim. O təfsirlər bunlardır:

1- *"Təfsiri-Kəşşaf"*, müəllifi: Zəməxşəri

2- *"Təfsiri-Kəbir"*, müəllifi: Fəxrəddin-Razi

3- *"Təfsiri Əbus-Suud"*

4- *"Məcməul-Bəyan"*, müəllifi: Təbərsi

5- *"Lübabüt-Təvil fi Məanit-Tənzil"*, müəllifi: əl-Xazin Əbu Məhəmməd əl-Bəğəvi

6- *"Mədarikut-Tənzil və Həqaiqüt-Təvil"*, müəllifi: ən-Nəsəfi

7- *"Ənvarüt-Tənzil"*, müəllifi: Qazi əl-Bəyzavi

8- *"Ruhül-Bəyan"*, müəllifi: Haqqı Əfəndi (İsmayıl Haqqı Bursəvi) və bunlardan başqa, tarix və hədis kitablarından da istifadə edilmişdir.

Bu kitaba baxan alimlərdən və digər maarif əhlindən istəyim odur ki, əgər bu kitabda bir səhv, qüsur və ya unudulmuş bir şey görsələr, mən həqiri üzrxah saysınlar. "İnsan unutqanlığa meyillidir, bəzən pəhləvan da səndələyər, bəzən qılınc da kəsməz",

- sözünü nəzərə alıb, mən həqirə insaf və mürüvvətdən kənar baxmasınlar və o səhvləri və qüsurları düzəltsinlər. Yardım Allahdandır, Ona etibar etdim. O, yardım edənlərin ən xeyirlisidir.

Bilik, sənət və mənəvi kamillik elmini öyrənmək insanlara xas olduğundan onların elmdən qafil olmaları caiz deyil. Qurani-Şərif və hədislərdə sənət və elm öyrənməyin təşviq edilməsi, elm sahiblərinin aqil, elmsizlərin cahil və zalım ləqəbi ilə yad edilməsi heç bir elm və fəzilət əhlindən gizli deyil.

İslam ümmətinin arasında ixtilaf zühur edəndən bəri hər bir qrup və onların rəhbərləri və ruhaniləri dinə zidd olan iddialarını dəstəkləmək üçün yalan hədislər uydurub, xalqın zehnini o yalanlarla doldurub, o yalanlara inandırıb, o yalanlar da, sanki, həqiqət imiş kimi onların arasında yayılıbdır.

Qurani-Şərifin inci kimi parlaq olan öyüd-nəsihətləri və hikmətləri xalqın zehnindən birdəfəlik silinib, xalqın rəhbərləri də Qurani-Şərifin mətləblərini onlara öyrətməkdən çəkinib, hətta avam xalq Qurani-Şərifin mətləblərindən danışanda şiddət və qorxutmaq yolu ilə onlara o mətləbləri tərk etməyi əmr edirlər. Hətta bizim bu dövrdə ruhanilərin əksəriyyəti Quranın mövzularından danışmağı haram elan edib, xalqa onu tərk etməyi təşviq edirlər. İddiaları da budur ki, imamlardan başqası Quranın mətləblərini dərk edə  bilməz.

Qurani-Şərifin açıq-aşkar olan ayələrində hər bir hökm və öyüd-nəsihət barəsində möminlərə xitab edilibdir və şübhəsiz ki, o hökm və nəsihətlərə əməl etmək vacib olub, möminlərin də ondan məsul olmaları bəhs olunan sözün doğruluğuna açıq bir dəlil və sübutdur. Əmirəl-möminin Hz. Əli öz xütbələrindən birində buyurubdur: "Quranı özünüzə imam və rəhbər seçin". Görəsən, Quranı imam seçməkdə məqsəd nədir? Məqsəd Qurani-Şərifdəki elm və hikmətləri dərk edib öyrənməkdən başqa bir şey deyil. Yenə Hz. Əli öz kəlamlarından birində insanları iki qismə ayırır: birinci qrup – alimlər, ikinci qrup elm öyrənənlərdir, onlardan başqasını isə yer üzündəki qədir-qiyməti olmayan heyvanlara – həşərata bərabər sayıbdır.

İnsanın şərəfi və iftixar qaynağı onun elmindədir. Vəhşicəsinə əməllər edən cahil və nadan şəxsləri islam dininə görə müsəlman

adlandırmaq böyük xətadır. Möhtərəm peyğəmbərimiz (s.ə.s) deyibdir: "Müsəlman o şəxsdir ki, xalq onun əlindən və dilindən salamat olar". (Buxari, İman 4; Nəsai, İman 9.)

İnsandan əmələ gələn hər bir xəta onun cəhalətindən qaynaqlanır. Hər bir dövrdə hansı elmlər və sənətlər yayılıbsa, o elm və sənəti öyrənmək lazımdır. Hansı dildə olursa olsun o elmi öyrənmək vacibdir. Peyğəmbərimizin dediyi kimi; "Elm Çində, olsa da, öyrənin". (bax: Acluni, *Kəşf'ü-l Xəfa*, I/138; Beyhaqi, *Şuəbu'l- İman*, II/254)

İslam dinində qadınlar da kişilər ilə eyni səviyyədə dini ehkamlar qarşısında bərabər olduğuna görə, müqəddəs şəriətin sahibinə görə, elm öyrənmək məsələsində də hər ikisi bərabər səviyyədədir. Onun dediyi kimi; "Hər bir müsəlman kişi və qadına elm öyrənmək lazımdır". (Kuleyni, Üsul, 1/30; İbn Macə, Müqəddimə, 17.) Elm ancaq dinin cüzi hökmlərindən ibarət deyil, necə ki, bu dövrdə xalqa bundan başqa heç bir elm öyrədilmir. Əksinə, əvvəlcə dini elmlər, ondan sonra bəşəriyyətin məişəti üçün lazım olan elmlər öyrədilməlidir. Məsələn, tarix, həndəsə, coğrafiya, riyaziyyat, astronomiya elmləri. Qurani-Şərifdə bu elmlərin hamısının öyrənilməsi üçün açıq-aşkar ayələr mövcuddur. Fəqihlər öz kitablarında mirasdan bəhs edəndə riyaziyyata əsaslanırlar, halbuki bu dövrdə elm dalınca gedən tələbələrin əksəriyyəti riyaziyyatdan bixəbərdirlər. Habelə namaz ehkamında fəqihlər qiblədən bəhs edəndə astronomiyaya əsaslanırlar, amma bu dövrdə fiqh müəllimləri və tələbələr tədris vaxtı qibləni təyin mövzusuna çatanda ustad və tələbələrin hamısı aciz və çaşqın qalırlar, bir bölgənin en və uzunluq dairələrini o bölgənin yer səthinə aid hesab edib, bölgənin hüdudlarını onun en və uzunluq dairəsi hesab edirlər.

Tarix elmi isə dəyərli bir elmdir. Qurani-Şərifdə tarix elmindən də bəhs edilir. Amma islam ümmətinin alim və tələbələri belə bir elmdən bixəbər qalıblar. Keçmiş dövrlərdəki alimləri araşdıran şəxslərə gizli deyil ki, onlar bütün bu bəhs edilən elmlərə agah olub, bu sahədə kitablar da yazıblar.

Qurani-Şərifin uca mətləbləri zülmət pərdəsinin arxasında qaldığına görə, islam ümmətinin içində cəhalət yayılıb, müsəlmanlar öz həvəs və nəfslərinə tabe olub, hər kəs özü üçün islam-

da bir yol seçib və onların arasından ədalət və insaf yox olub, zülm açıq-aşkar yayılıbdır.

Əmirəl-möminin Hz. Əli (ə.s) hər bir elmə sahib olmaqdan başqa, riyaziyyat elminə də agah idi. Bir gün o cənab ayağını üzəngiyə qoyanda riyaziyyat elminə agah olan bir yəhudi o cənabdan soruşdu ki, ya əmirəl-möminin, o hansı ədəddir ki, onun bölünməsi 9-da biri qədər olsun?* (*Yəni onun yarısı və 3-dən biri, 4-dən biri, 5-dən biri, 6-dan biri, 7-dən biri, 8-dən biri, 9-dan biri, 10-dan biri olsun?) O cənab elə ayağı üzəngidə olaola buyurdu: "Həftənin günlərini bir-birinə vur, o saydan ilin günlərinə hasil olan rəqəm sənin cavabındır". O cənab bu sözü buyurub, atına minib yola düşdü. Ondan sonra yəhudi gedib hesabladı və cavabın doğru olduğunu gördü. (Əgər o hesabı burada qeyd etsəm, uzunçuluq olub, əsl mətləbdən çıxmış olarıq. Kitabın mövzusundan başqa, bir mətləbə qarışmaq gözəl bir şey deyildir). Dünya və axirət səadəti ancaq elmlə mümkündür. Elm öz sahibinə ancaq şərəf verər. Əgər Qurani-Şərifin ayələrini birbir mülahizə eləsən, görərsən ki, elmin ucalığına və elm sahibinin fəzilətinə, ona zinət verənin elm olduğuna necə dəlildir. Dinin zahiri və batini ilk mərtəbəsi Allah-Təalanı bilməkdir və bu da ancaq elm yolu ilə mümkündür. Bütpərəstlik, yəni Allah-Təalaya şirk qoşmaq, hamısı cəhalət və nadanlıqdan qaynaqlanır. Atababanı təqlid etməyi tərk edib, elmin nuru ilə gedənlər zülmət və cəhalət vadisindən xilas olub, maarif aləminin zirvələrində məskun olublar.

Necə fəzilətli şəxslər elmdən uzaqlaşmaları səbəbi ilə səfil insanlar qrupuna qatılıb, zillət vadisində çaşqın və sərgərdan qalıblar. Amma necə adi insanlar elm öyrənmək üçün zamanlarını verib, zəhmət və çətinliklərə qatlanmağı özlərinə şəfa sayıb, az bir zamanda sərvət və səadət sahibi oldular. Bunu yaxşı anla, fürsəti qənimət bil və şükür edənlərdən ol!

Bundan sonra Qurani-Şərifin təfsiri başlayır. Müvəffəq edən və yardım edənlərin ən xeyirlisi Odur. Bu təfsir "Kəşfü-l-həqaiq an nükəti-l-ayati və-d-dəqaiq" adıyla adlanıb, 3 cilddən ibarət olacaqdır. İlk cildin əvvəli Fatihə, axırı Tövbə, 2-ci cildin əvvəli Yunus, axırı Ənkəbut, 3-cü cildin əvvəli Rum, axırı Nas surəsidir. Buna görə, təfsir üç cilddən ibarət olacaqdır ki, asanlıqla daşına

bilsin. Habelə hər bir ayəni tapmaq asan olsun deyə, ayələr nizam ilə sıralanıb. Hər bir cildə daxil olan ayələrin təfsiri verilib. Və hər bir surədəki ayələrin sayı o surənin əvvəlində qeyd olunub, ondan sonra təfsir əsnasında nizam içində bəyan olunub.

"Hürufu-müqəttə`" (kəsik hərflər) ki, bəzi surələrin əvvəllərində vaqe olubdur, məsələn, Əlif Ləm Mim, Əlif Ləm Ra, Ha Mim, Ta Sin Mim kimi. Bunların mənalarında böyük ixtilaflar ediblər. Təfsirçilərin hər biri bir məna verib, hamısından yaxşısı Zəməxşərinin verdiyi mənadır ki, surələrin əvvəlində gələn bu hərflər o surələrin adıdır. Mən həqir də bu fikri mənimsəyib, bu hərflərin o surələrin adı olması fikrini qeyd etdim.

**Təfsiru Kəşfil-Həqayiq an Nükətil-Ayəti vəd-Dəqayiq**

Sərvət və səxavəti ilə məşhur maarifpərvər cənab Hacı Zeynalabidin Tağıyevin ianə və ihtimamilə çap olunmuşdur

## FATİHƏ SURƏSİ

1-ci surədir. Məkkədə nazil olub,
7 ayə, 28 kəlmə və 140 hərfdir.

**Qurani-Şərifi hər dəfə oxuyanda birinci gərək - Əuzu billahi minə-ş-şeytanir-racim - deyib, ondan sonra Quran oxumağa başlamaq lazımdır və mənası da belədir:** (اَعُوذُ) **- yəni pənah aparıram,** (بِاللهِ) **– Allah-Təalaya,** (مِنَ الشَّيْطَانِ الرَّجِيمِ) **– Allah-Təalanın dərgahından qovulmuş şeytandan.**

بِسْمِ اللهِ الرَّحْمَنِ الرَّحِيمِ

**1) (بِسْمِ اللهِ) – yəni Allah-Təalanın mübarək adı ilə başlayıram, (الرَّحْمَنِ) - elə bir Allah-Təala ki, onun rəhməti və neməti dünya və axirətdə məxluqata çatar.** (Dünyada külli məxluqata, axirətdə ancaq möminlərə və bu səbəbdən dua məqamında belə deyilir: "Ey dünya və axirətdə mərhəmət edən Rəhman!), **(الرَّحِيمِ) - elə bir Allah-Təala ki, onun rəhmət və neməti dünyada heç kimə fərq qoymadan külli məxluqata çatar və bu səbəbdən dua məqamında deyilir:** (ey dünyada mərhəmət edən!) Hərçənd Rəhim sözünün mənası Rəhman adının içində mövcuddur, lakin Allah-Təalanın neməti dünyada möminə çatan

اَلْحَمْدُ لِلّٰهِ رَبِّ الْعَالَمِينَ ﴿٢﴾ اَلرَّحْمٰنِ الرَّحِيمِ ﴿٣﴾ مَالِكِ يَوْمِ الدِّينِ ﴿٤﴾ اِيَّاكَ نَعْبُدُ وَاِيَّاكَ نَسْتَعِينُ ﴿٥﴾ اِهْدِنَا الصِّرَاطَ الْمُسْتَقِيمَ ﴿٦﴾

---

kimi, kafirə də, bəlkə, daha çox çatmasını təkidlə bildirməkdən ötrü bu qeyd olundu. Rəhman sözünün hərfləri Rəhimdən çox olduğu üçün mənasında da çoxluq var olundu. Rəhman adını Allah-Təaladan başqa, heç kimə demək olmaz. Amma Rəhim adını demək olar və hər iki ad bu məqamda məcazi olaraq nemət mənasında işlədilibdir. Çünki bu iki kəlmənin həqiqi mənaları qəlbə meyil və hüsni-rəğbəti ehtiva edir. Allah-Təala bu sifətdən uzaq olduğu üçün məcazi mənasında verilib).

**2) (اَلْحَمْدُ لِلّٰهِ) - bütün tariflər və gözəl sifətlər Allah-Təala üçündür. Allah-Təaladan başqa, heç kimə layiq bir tərif deyildir. (رَبِّ الْعَالَمِينَ) Allah-Təala bütün məxluqata və varlığa sahib və onlara tərbiyə verəndir. Ona görə, hər bir şəxsin halına münasib dünyada onun üçün güzəran təyin edibdir.**

**3) (اَلرَّحْمٰنِ الرَّحِيمِ) - mənaları daha əvvəl bəyan edildi. Yenidən qeyd etməyə ehtiyac yoxdur.**

**4) (مَالِكِ يَوْمِ الدِّينِ) - qiyamət gününün sahibi Allah-Təaladır, o gündə hər bir şəxsə öz əməlinin cəzasını verər.** (Dünyada yaxşı əməl sahibinə mükafat və pis əməl sahibinə cəza verər). **Keçən bu dörd ayə tərif və həmd üçündür. Bundan sonra gələn ayələr bəndə tərəfindən Allah-Təalaya niyaz ərz etmək, hər bir işdə yardım və haqq yola hidayət etməsini istəmək üçündür.**

**5) (اِيَّاكَ نَعْبُدُ) – son dərəcə itaət və zillətlə ancaq sənə ibadət edib, ibadətimizi ancaq sənə məxsus eləyib, səndən başqasını ibadətimizdə sənə şərik qoşmarıq.** (Nə gözəl sözdür, həqiqətən də bir Allah ki, bizim ölməyimiz və dirilməyimiz onun qüdrətli əlində olsun, O, əlbəttə, ibadətə layiqdir, Ondan başqası layiq deyildir). **(وَاِيَّاكَ نَسْتَعِينُ) - ancaq səndən kömək istəyirik, bütün işlərimizdə səndən başqasından kömək istəmirik.**

**6) (اِهْدِنَا الصِّرَاطَ الْمُسْتَقِيمَ) - bizi düz yola hidayət et və o yolda bizi sabit elə. Ta ki o yoldan kənar olmayaq.** (İslam dini üzrə bizi sabit və bərqərar et. Namaz qılanlar 5 vaxt namazda bu duanı edib, islamda sabit olmağı Allah-Təaladan xahiş edirlər. Amma onların çoxunda müsəlman xüsusiyyətlərindən heç biri olmayıb, dualarında yalançı, batində islamdan çıxmış olurlar).

### *Fatihə surəsi*

صِرَاطَ الَّذٖينَ اَنْعَمْتَ عَلَيْهِمْ ۙ غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلَا الضَّٓالّٖينَ ﴿٧﴾

---

**7) (صِرَاطَ الَّذٖينَ اَنْعَمْتَ عَلَيْهِمْ) - bizi o şəxslərin yolunda bərqərar et ki, islama daxil olub, sabit olmaqda onlara nemət bəxş eləyibsən. (غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ) - o şəxslərin yolu olsun ki, onlar qəzəb olunan şəxslərdən olmasınlar.** (Çünki qəzəb olunan şəxslər Allah-Təalaya asi olub, Onun yolundan kənar olanlardır. Bizə islamda o yol lazımdır ki, iman əhli o yolu gedib). **(وَلَا الضَّٓالّٖينَ) - asi şəxslərin də yolu olmasın ki, əsla hidayət tapmayıb həmişəlik zəlalətdə olmasınlar.**

## əl-BƏQƏRƏ SURƏSİ

2-ci surədir. Mədinədə nazil olub, 286 ayə, 6121 kəlmə və 25500 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الٓمٓ ﴿١﴾ ذٰلِكَ الْكِتَابُ لَا رَيْبَ فِيهِ هُدًى لِلْمُتَّقِينَ ﴿٢﴾ اَلَّذِينَ
يُؤْمِنُونَ بِالْغَيْبِ وَيُقِيمُونَ الصَّلٰوةَ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ ﴿٣﴾ وَالَّذِينَ يُؤْمِنُونَ بِمَآ اُنْزِلَ اِلَيْكَ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (الٓمٓ) - bu surənin ismi və adıdır. Yəni bu surə Əlif Ləm Mim surəsidir.** (Allah-Təala bu surənin adını Əlif Ləm Mim qoyubdur. Lakin ənənə olaraq onun məşhur kəlmələrindən birini ad olaraq ona veriblər. Surənin içində keçən “bəqərə” (inək) kəlməsini bu surəyə ad qoyublar. Necə ki, yuxarıda qeyd olundu və bundan sonra gələn surələr ki, onların əvvəllərində bu qisim hərflər qeyd olunub, onlar tamamən o surələrin adıdır. Amma necə ki, ənənə olaraq surəyə Bəqərə adı qoyulubdur, o surələrin də hər birinə ənənə olaraq ayrı bir ad qoyulub, ənənədəki adları ilə məşhur olublar).

**2) (ذٰلِكَ الْكِتَابُ) - bu Quran kitabı kamildir. Onda heç bir nöqsan yoxdur. (لَا رَيْبَ فِيهِ) - heç bir şəkk və şübhə yoxdur ki, bu kitab Allah-Təala tərəfindəndir. (Hərçənd demək olmaz ki, Qurana şəkk və şübhə edən yoxdur. Lakin məqsəd odur ki, əgər insaf üzrə fikir verilsə, məlum olar ki, bu Quran ilahi bir kəlamdır, insan kəlamı deyil və layiq deyil ki, ona şübhə edilsin). (هُدًى لِلْمُتَّقِينَ) - bu Quran müttəqilərdən ötrü doğru yolu göstərəndir.** (Allah-Təalanın haram etdiyi şeyləri tərk edib, Onun əmrlərini icra edən şəxsə müttəqi deyilir).

**3) (اَلَّذِينَ) - müttəqilərin xüsusiyyətlərindən biri odur ki, - (يُؤْمِنُونَ بِالْغَيْبِ) qaibanə şəkildə Hz. Məhəmməd peyğəmbərə və Qurana iman edərlər.** (Hz. Peyğəmbərdən sonra ta bu zamana kimi nə qədər iman edən müsəlman olubsa və bundan sonra yenə gəlib iman edəcək olanların hamısı bu ayənin ehtivasına daxildirlər, amma peyğəmbərin dövründə yaşayıb iman edən şəxslərdən ötrü peyğəmbərin və Quranın əmri aşkar olduğu üçün ona qeybə iman demək olmaz). **(وَيُقِيمُونَ الصَّلٰوةَ) - və namaz qılarlar. (وَمِمَّا رَزَقْنَاهُمْ) - o nemətlərdən ki, onlara vermişik, (يُنْفِقُونَ) - möhtac olan şəxslərə ehsan edərlər.**

**4) (وَالَّذِينَ) - müttəqilərin xüsusiyyətlərindən biri də odur ki, (يُؤْمِنُونَ) - iman edirlər, (بِمَآ اُنْزِلَ اِلَيْكَ) - o Qurana ki, sənə nazil olubdur** (Tövrat və

وَمَٓا اُنْزِلَ مِنْ قَبْلِكَۚ وَبِالْاٰخِرَةِ هُمْ يُوقِنُونَۜ ﴿٤﴾ اُولٰٓئِكَ عَلٰى هُدًى مِنْ رَبِّهِمْ وَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ
﴿٥﴾ اِنَّ الَّذِينَ كَفَرُوا سَوَٓاءٌ عَلَيْهِمْ ءَاَنْذَرْتَهُمْ اَمْ لَمْ تُنْذِرْهُمْ لَا يُؤْمِنُونَ ﴿٦﴾ خَتَمَ اللّٰهُ عَلٰى قُلُوبِهِمْ وَعَلٰى
سَمْعِهِمْۜ وَعَلٰٓى اَبْصَارِهِمْ غِشَاوَةٌۘ وَلَهُمْ عَذَابٌ عَظِيمٌ۟ ﴿٧﴾ وَمِنَ النَّاسِ مَنْ يَقُولُ اٰمَنَّا بِاللّٰهِ وَبِالْيَوْمِ
الْاٰخِرِ وَمَا هُمْ بِمُؤْمِنِينَۢ ﴿٨﴾ يُخَادِعُونَ اللّٰهَ وَالَّذِينَ اٰمَنُواۚ وَمَا يَخْدَعُونَ اِلَّٓا اَنْفُسَهُمْ وَمَا يَشْعُرُونَۜ ﴿٩﴾

---

İncilə də). **(وَمَٓا اُنْزِلَ مِنْ قَبْلِكَ) O kitablara ki, səndən əvvəl nazil olub** (Tövrat və İncil) **(وَبِالْاٰخِرَةِ) - qiyamət gününə, (هُمْ يُوقِنُونَ) - o müttəqilər qəti bilirlər ki, qiyamət, əlbəttə, vaqe olacaqdır.**

**5) (اُولٰٓئِكَ عَلٰى هُدًى مِنْ رَبِّهِمْ) - o müttəqilər ki, onların xüsusiyyətləri qeyd olundu, onlardır öz rəbləri Allah-Təaladan hidayət və nur içində olub, haqq dində sabit olanlar. (وَاُولٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) - əlbəttə, onlardır axirət əzabından nicat tapıb, həmişəlik nemətə yetişənlər.**

**6) (اِنَّ الَّذِينَ كَفَرُوا) - həqiqətən, o şəxslər ki, Quranı inkar edib, (سَوَٓاءٌ عَلَيْهِمْ) - onlardan ötrü bərabərdir, (ءَاَنْذَرْتَهُمْ) - onları ilahi əzabla qorxudasan, (اَمْ لَمْ تُنْذِرْهُمْ) - ya da qorxutmayasan, (لَا يُؤْمِنُونَ) - bu Qurana iman edən deyillər.**

**7) (خَتَمَ اللّٰهُ عَلٰى قُلُوبِهِمْ) -** (ey Məhəmməd), **bu müşriklər küfr və inadlarında sabit və bərqərar olduqlarına görə, Allah-Təala onların qəlblərinə möhür vurubdur, ta ki heç bir xeyir olan əməli dərk etməsinlər. (وَعَلٰى سَمْعِهِمْ) - habelə onların qulaqlarına möhür vurubdur ki, haqq sözləri eşitməsinlər. (وَعَلٰٓى اَبْصَارِهِمْ غِشَاوَةٌ) - və onların gözlərinin qabağında olan inad və cəhalət pərdəsi onların haqqı görməsinə mane olub, heç vaxt haqqı dərk etməzlər. (وَلَهُمْ) - onlardan ötrü, (عَذَابٌ عَظِيمٌ) - axirət günündə böyük əzab vardır.** (Bundan sonra gələn 13 ayə münafiqlər haqqında nazil olubdur. Münafiq o şəxsdir ki, diliylə iqrar edib, qəlbində iman etmir. Onların rəisləri Mədinədə Abdullah ibn Übey idi).

**8) (وَمِنَ النَّاسِ مَنْ يَقُولُ اٰمَنَّا بِاللّٰهِ) –** (ey Məhəmməd), **insanlardan bəzi şəxslər vardır ki, deyirlər: Allah-Təalaya iman etmişik, (وَبِالْيَوْمِ الْاٰخِرِ) - və qiyamət gününə,** (bu kəlamı deyən şəxs Mədinə əhlindən Abdullah ibn Übey və ona tabe olanlar idi). **(وَمَا هُمْ بِمُؤْمِنِينَ) –** (ey Məhəmməd), **o münafiqlər bu sözü yalandan deyib, iman edən deyildilər.**

**9) (يُخَادِعُونَ اللّٰهَ) - bu münafiqlər məkr və hiylə edirlər Allah-Təalaya qarşı. (وَالَّذِينَ اٰمَنُوا) – və o şəxslərə qarşı ki, Qurana iman ediblər.** (Bu məkr və hiylə odur ki, qəlblərində iman etməsələr də, yalandan iman izhar edirlər). **(وَمَا يَخْدَعُونَ) - münafiqlər məkr, hiylə etməzlər** (edə bilməzlər), **(اِلَّٓا اَنْفُسَهُمْ) - ancaq öz zərərlərinə edərlər.** (Çünki bu məkr və hiylənin cəzasına çatacaqlar). **(وَمَا يَشْعُرُونَ) - amma onlar özlərinə varid olan zərəri başa düşməyib, öz məkr və hiylələrini tərk etmirlər.**

فِي قُلُوبِهِمْ مَرَضٌ ۙ فَزَادَهُمُ اللّٰهُ مَرَضًا ۚ وَلَهُمْ عَذَابٌ اَلِيمٌ ۙ بِمَا كَانُوا يَكْذِبُونَ ﴿١٠﴾ وَاِذَا قِيلَ لَهُمْ لَا
تُفْسِدُوا فِي الْاَرْضِ ۙ قَالُوٓا اِنَّمَا نَحْنُ مُصْلِحُونَ ﴿١١﴾ اَلَا اِنَّهُمْ هُمُ الْمُفْسِدُونَ وَلٰكِنْ لَا يَشْعُرُونَ
﴿١٢﴾ وَاِذَا قِيلَ لَهُمْ اٰمِنُوا كَمَآ اٰمَنَ النَّاسُ قَالُوٓا اَنُؤْمِنُ كَمَآ اٰمَنَ السُّفَهَآءُ ۜ اَلَا اِنَّهُمْ هُمُ السُّفَهَآءُ
وَلٰكِنْ لَا يَعْلَمُونَ ﴿١٣﴾ وَاِذَا لَقُوا الَّذِينَ اٰمَنُوا قَالُوٓا اٰمَنَّا ۚ وَاِذَا خَلَوْا اِلٰى شَيَاطِينِهِمْ ۙ قَالُوٓا اِنَّا مَعَكُمْ
ۙ اِنَّمَا نَحْنُ مُسْتَهْزِؤُنَ ﴿١٤﴾

---

**10) (فِي قُلُوبِهِمْ مَرَضٌ) - o münafiqlərin qəlblərində nifaq xəstəliyi vardır. (فَزَادَهُمُ اللّٰهُ مَرَضًا) – Allah-Təala da Qurani-Şərifi nazil etməklə onların xəstəliyini daha da artırdı.** (Quran ayələri çox nazil olduqca onların qəzəbi daha da artırdı). **(وَلَهُمْ عَذَابٌ اَلِيمٌ) - o münafiqlərdən ötrü qiyamət günündə daha çox şiddətli əzab vardır. (بِمَا كَانُوا يَكْذِبُونَ) - o səbəbə görə ki, Quranın ayələrini təkzib edirdilər.**

**11) (وَاِذَا قِيلَ لَهُمْ) – o zaman ki, o münafiqlərə deyildi, (لَا تُفْسِدُوا فِي الْاَرْضِ) - yer üzündə fəsad törətməyin.** (Münafiqlərin fəsadı xalqın peyğəmbərə iman etmələrinə mane olmaq idi). **(قَالُوٓا) - münafiqlər cavab verib dedilər: (اِنَّمَا نَحْنُ مُصْلِحُونَ) - həqiqətən, bizim işimiz islah etməkdir. Biz heç vaxt fəsad törətmərik.**

**12) (اَلَا) - xəbərdar olun,** (ey möminlər, münafiqlər yalandan bu cavabı verirlər). **(اِنَّهُمْ هُمُ الْمُفْسِدُونَ) - həqiqətən, onlar fəsad törədəndirlər. (وَلٰكِنْ لَا يَشْعُرُونَ) - lakin şüurları yoxdur** (və dərk etmirlər ki, fəsad törətmək nə qədər pis bir əməldir və Allah-Təala tərəfindən onlar üçün nə qədər əzab var).

**13) (وَاِذَا قِيلَ) – o zaman ki, deyildi, (لَهُمْ) - o münafiqlərə,** (yəni möminlər dedilər münafiqlərə:) **(اٰمِنُوا) - iman edin bu Qurana, (كَمَآ اٰمَنَ النَّاسُ) - necə ki, sizdən başqaları iman gətirirlər. (قَالُوٓا) – münafiqlər dedilər: (اَنُؤْمِنُ) - bəs iman gətirək, (كَمَآ اٰمَنَ السُّفَهَآءُ) necə ki, səfeh şəxslər iman gətiriblər? (اَلَا) - xəbərdar olun, ey möminlər, (اِنَّهُمْ هُمُ السُّفَهَآءُ) - əlbəttə, səfeh şəxslər münafiqlərdir, (وَلٰكِنْ لَا يَعْلَمُونَ) - lakin öz səfehliklərinə agah deyillər.** (Münafiqlərin başçısı Abdullah ibn Übey və onun yoldaşlarından ibarət bir qrup peyğəmbərlə qarşılaşanda iman izhar elədilər ki, möminlər onların qəlblərində olanı bilməsin, Allah-Təala gələn ayə ilə onları təkzib edib və onların nifaqını aşkar edib, möminləri xəbərdar elədi).

**14) (وَاِذَا لَقُوا الَّذِينَ اٰمَنُوا) – o zaman ki, münafiqlər mömin şəxslərlə qarşılaşdılar, (قَالُوٓا) – o möminlərə dedilər: (اٰمَنَّا) - iman gətirmişik Məhəmmədə** (s.ə.s) **və Qurana, (وَاِذَا خَلَوْا) - amma xəlvətdə olanda, (اِلٰى شَيَاطِينِهِمْ) - öz şeytanları ilə,** (yəni o şəxslərlə ki, onlar kimi münafiq idilər), **(قَالُوٓا اِنَّا مَعَكُمْ) - dedilər: həqiqətən, biz sizin ilə birlikdə sizin dininizdənik. (اِنَّمَا نَحْنُ مُسْتَهْزِؤُنَ) - həqiqətən, biz möminlərə Qurana iman gətirdiyimizi deməklə, onlarla istehza edirik.**

اَللّٰهُ يَسْتَهْزِئُ بِهِمْ وَيَمُدُّهُمْ ف۪ي طُغْيَانِهِمْ يَعْمَهُونَ ﴿١٥﴾ اُو۬لٰٓئِكَ الَّذ۪ينَ اشْتَرَوُا الضَّلَالَةَ بِالْهُدٰى فَمَا
رَبِحَتْ تِجَارَتُهُمْ وَمَا كَانُوا مُهْتَد۪ينَ ﴿١٦﴾ مَثَلُهُمْ كَمَثَلِ الَّذِي اسْتَوْقَدَ نَارًا فَلَمَّٓا اَضَٓاءَتْ مَا حَوْلَهُ
ذَهَبَ اللّٰهُ بِنُورِهِمْ وَتَرَكَهُمْ ف۪ي ظُلُمَاتٍ لَا يُبْصِرُونَ ﴿١٧﴾ صُمٌّ بُكْمٌ عُمْيٌ فَهُمْ لَا يَرْجِعُونَ ﴿١٨﴾
اَوْ كَصَيِّبٍ مِنَ السَّمَٓاءِ

---

**15) (اَللّٰهُ يَسْتَهْزِئُ بِهِمْ) – Allah-Təala o münafiqlərin istehza etməsinin cəzasını onlara verər. (وَيَمُدُّهُمْ ف۪ي طُغْيَانِهِمْ) - o münafiqlər küfr və zəlalətlərində sabit və möhkəm olduqlarına görə, Allah-Təala da onları bunda qüvvətləndirər. (يَعْمَهُونَ) - küfr və zəlalətlərində çaşqın qalıb, öz işlərində aciz olarlar.** (Allah-Təalanın bu kəlamı doğru olub, sonradan islam qüvvət tapınca, münafiqlər öz əməllərində çaşqın qalıb, müsəlmanlara sığındılar).

**16) (اُو۬لٰٓئِكَ الَّذ۪ينَ) – o münafiqlər o şəxslərdir ki, (اشْتَرَوُا الضَّلَالَةَ)- zəlaləti və asiliyi aldılar, (بِالْهُدٰى) - hidayət və düz yolda olmanın əvəzində,** (yəni küfrü imana üstün saydılar). **(فَمَا رَبِحَتْ) - mənfəət vermədi, (تِجَارَتُهُمْ) - onların alış-verişləri,** (hansı ki, iman əvəzinə küfrü seçdilər). **(وَمَا كَانُوا مُهْتَد۪ينَ) - münafiqlər ticarət yolunda hidayət tapan və bəsirət sahibi olan deyillər.** (Çünki ticarət işinə agah olan şəxs pisi yaxşıdan üstün saymaz, amma münafiqlər yaxşının əvəzinə pisi və imanın əvəzinə küfrü seçdilər).

**17) (مَثَلُهُمْ) - öz nifaqlarında münafiqlərin məsəli (كَمَثَلِ الَّذِي) - o şəxslərin misli kimidir ki, (اسْتَوْقَدَ نَارًا) –** (mənfəət əldə etmək üçün) **bir od yandırıb, (فَلَمَّٓا اَضَٓاءَتْ مَا حَوْلَهُ) – o zaman ki, od alovlanıb, ətrafında olan hər bir şeyi aydınlatdı, (ذَهَبَ اللّٰهُ بِنُورِهِمْ) – Allah-Təala bir səbəb yaradıb, qəflətən onların aydınlığını yox edib, (وَتَرَكَهُمْ) - və qoyar onları, (ف۪ي ظُلُمَاتٍ) - qaranlıqlar içində, (لَا يُبْصِرُونَ) – elə bir halətdə ki, gözləriylə heç bir şeyi dərk edə bilməzlər, münafiqlərin halı, belədir ki, dünyada iman izhar edib, axirətə köçəndə iddia elədikləri imanın nuru sönüb, əbədi zülmətə** (ilahi əzaba) **düçar olacaqlar.**

**18) (صُمٌّ) - o münafiqlər haqqı eşitməkdə kardırlar, (بُكْمٌ) - haqqı danışmaqda laldırlar, (عُمْيٌ) - haqqı görməkdə kordurlar, (فَهُمْ) - o münafiqlər, (لَا يَرْجِعُونَ) - nifaq və zəlalətdən hidayət və haqq tərəfinə dönməzlər.**

**19) (اَوْ كَصَيِّبٍ مِنَ السَّمَٓاءِ) -** (bu ayə* münafiqlər üçün xüsusi bir məsəldir).

*(*__Qeyd:__ Bu məsəlin münafiqlərlə əlaqəsi bu şəkildədir: necə ki, göy gurultusu və ildırıma düçar olan şəxs son dərəcə qorxu içində olub, heç bir tərəfə qaçıb xilas olmağa qadir olmaz. Münafiqlərin halı belədir ki, Qurani-Şərifin ildırım kimi olan ayələri onların gözlərini kor edib və haqqa dəvət edənin səsi göy gurultusu kimi qulaqlarını kar edər. Belə bir halətdə münafiqlər barmaqlarını qulaqlarına qoyub, Quran ayələrini eşitməkdən özlərini kənar edib, küfr və zəlalət biyabanında çaşqın və*

فِيهِ ظُلُمَاتٌ وَرَعْدٌ وَبَرْقٌ ۚ يَجْعَلُونَ اَصَابِعَهُمْ فِيٓ اٰذَانِهِمْ مِنَ الصَّوَاعِقِ حَذَرَ الْمَوْتِ ۜ وَاللّٰهُ مُحِيطٌ
بِالْكَافِرِينَ ﴿١٩﴾ يَكَادُ الْبَرْقُ يَخْطَفُ اَبْصَارَهُمْ كُلَّمَآ اَضَآءَ لَهُمْ مَشَوْا فِيهِ وَاِذَآ اَظْلَمَ عَلَيْهِمْ قَامُوا ۜ
وَلَوْ شَآءَ اللّٰهُ لَذَهَبَ بِسَمْعِهِمْ وَاَبْصَارِهِمْ ۜ اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ ۟ ﴿٢٠﴾ يَآ اَيُّهَا النَّاسُ اعْبُدُوا
رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ وَالَّذِينَ مِنْ قَبْلِكُمْ لَعَلَّكُمْ تَتَّقُونَ ۙ ﴿٢١﴾

---

*sərgərdan qalıb, iman və doğru yol tərəfinə meyil və rəğbət etmədilər. Qeyd olunduğu kimi, münafiqlərin halı hər bir zamanda belədir).*

**Bu münafiqlərin halı o şəxslərin halı kimidir ki, biyabanda onları yağış tutub, (فِيهِ) - o yağışda olsun, (ظُلُمَاتٌ) - qaranlıqlar, (وَرَعْدٌ) - çox şiddətli ildırım səsi, (وَبَرْقٌ) - və ildırım olsun. (يَجْعَلُونَ) - o şəxslər qoyarlar, (اَصَابِعَهُمْ) - barmaqlarını, (فِيٓ اٰذَانِهِمْ) - qulaqlarına, (مِنَ الصَّوَاعِقِ) - şiddətli olan səsin qorxusundan ki, (حَذَرَ الْمَوْتِ) – birdən o səsin, ya da ildırımın səbəbinə ölüm onlara gəlib, həlak olarlar. (وَاللّٰهُ مُحِيطٌ بِالْكَافِرِينَ) - halbuki Allah-Təala hər bir tərəfdən kafirlərə hakimdir.** (Onlar ildırımın səsindən və özündən qorxdular ki, birdən həlak olarlar, amma Allah-Təaladan qorxmazlar, halbuki Allah-Təala kafirlərə hakim olub, onların hamısını ildırımsız həlak edəcəkdir). (Keçən ayədə ildırım qeyd olundu, bu gələn ayədə həmin ildırımın xüsusiyyətini bəyan edir).

**20) (يَكَادُ الْبَرْقُ) – sanki, o ildırım işığının çoxluğundan, (يَخْطَفُ) - qəflətən qoparıb kor edər, (اَبْصَارَهُمْ) - onların gözlərini, (كُلَّمَآ) – nə zaman ki (اَضَآءَ لَهُمْ) - ildırım işıqlandırdı onlardan ötrü onların ətrafını, (مَشَوْا فِيهِ) - o işıqda yol gedərlər, (وَاِذَآ اَظْلَمَ) – nə zaman ki ildırım sakit olub, hava qaranlıq oldu, (عَلَيْهِمْ) - o şəxslər ki, işıqlıqda idilər, (قَامُوا) – durub, çaşqın qalarlar, hansı tərəfə getməyi bilməzlər. (وَلَوْ شَآءَ اللّٰهُ) - belə olan halda əgər Allah-Təala istəsə, ildırımın səsini artırar. (لَذَهَبَ) - əlbəttə, alıb** (kar) **edər, (بِسَمْعِهِمْ) - onların qulaqlarını, ildırımın nurunu artıraraq alıb kor edər, (وَاَبْصَارِهِمْ) - onların gözlərini, (اِنَّ اللّٰهَ) - həqiqətən, Allah-Təala, (عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) - hər bir şeyə qadirdir,** (münafiqlərin əhvalı belədir ki, haqqa dəvət edənin səsi ildırım kimi az qalır ki, onların gözlərini və qulaqlarını kor və kar eləsin. Gah haqq tərəfinə meyil etməklə ildırım zahir olan anda olan kimi onlardan ötrü aydınlıq zahir olar, amma elə ki haqdan öz küfr və zəlalətlərinə tərəf meyil etdilər, o vaxt küfr və zəlalət çölündə avara və sərgərdan halda dolanıb, heç bir tərəfə çıxa bilməzlər).

**21) (يَآ اَيُّهَا النَّاسُ اعْبُدُوا) - ey insan tayfası, ibadət edin, (رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ) - sizə tərbiyə verən rəbb Allah-Təalaya ki, sizi yaradıbdır, (وَالَّذِينَ مِنْ قَبْلِكُمْ) - və yaradıbdır o şəxsləri ki, sizdən əvvəl keçiblər. (لَعَلَّكُمْ) - əlbəttə, siz Allah-Təalaya ibadət etməkdə, (تَتَّقُونَ) - gərək təqva edib müttəqilərdən hesab olunasınız.** (Əlbəttə, Allah-Təalaya ibadət edib, haramı tərk eləyib, vacib əmrləri icra edən şəxs müttəqilərdən hesab olunar)**.**

اَلَّذي جَعَلَ لَكُمُ الْاَرْضَ فِرَاشًا وَالسَّمَآءَ بِنَآءً وَاَنْزَلَ مِنَ السَّمَآءِ مَآءً فَاَخْرَجَ بِه مِنَ الثَّمَرَاتِ رِزْقًا
لَكُمْ فَلاَ تَجْعَلُوا لِلّٰهِ اَنْدَادًا وَاَنْتُمْ تَعْلَمُونَ﴿٢٢﴾ وَاِنْ كُنْتُمْ فِي رَيْبٍ مِمَّا نَزَّلْنَا عَلٰى عَبْدِنَا فَاْتُوا
بِسُورَةٍ مِنْ مِثْلِه وَادْعُوا شُهَدَآءَكُمْ مِنْ دُونِ اللّٰهِ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٢٣﴾ فَاِنْ لَمْ تَفْعَلُوا وَلَنْ تَفْعَلُوا
فَاتَّقُوا النَّارَ الَّتِي وَقُودُهَا النَّاسُ وَالْحِجَارَةُ

---

**22) (اَلَّذِي) - və o Allah-Təala ki, ona ibadət etməklə əmr olunubsunuz, onun xüsusiyyətlərindən biri budur ki, (جَعَلَ) - etdi, (لَكُمُ الْاَرْضَ) - sizlər üçün yer üzünü, (فِرَاشًا) - bir açıq düz döşək ki, onda ayaqlarınız sabit dursun. (وَالسَّمَآءَ) - və etdi sizdən ötrü səmanı, (بِنَآءً) - bir qübbə və tavan, (necə ki, hər bir evin tavanı və qübbəsi olur, həmçinin səma da yerdən ötrü tavan və qübbə kimidir. (وَاَنْزَلَ مِنَ السَّمَآءِ مَآءً) – səmadan sizin üçün su endirdi, (فَاَخْرَجَ بِهِ مِنَ الثَّمَرَاتِ) - o suyun səbəbinə hər bir növ meyvələri sizin üçün yerdən çıxardı, (رِزْقًا لَكُمْ) – ta ki, o meyvələr sizdən ötrü ruzi olsun. (فَلَا تَجْعَلُوا لِلّٰهِ) – etməyin** (qoşmayın) **Allah-Təalaya (اَنْدَادًا) - zidlər və şəriklər, (وَاَنْتُمْ تَعْلَمُونَ) - halbuki siz agahsınız ki, bu şeyləri yaradan Allah-Təaladır və Onun heç bir ziddi və şəriki yoxdur. Belə olan halətdə Allah-Təalaya şərik qoşmaq son dərəcə zülmdür.** (Bu ayə o şəxslərə xitabdır ki, Quranı Allah-Təalanın kitabı saymayıb, peyğəmbərə nisbət edirdilər ki, sən bu Quranı başqasından alıbsan).

**23) (وَاِنْ كُنْتُمْ فِي رَيْبٍ مِمَّا نَزَّلْنَا عَلٰى عَبْدِنَا) - ey Quranı inkar edən şəxslər, bu Quran ki, qulumuza** (Hz. Məhəmmədə) **nazil eləmişik, əgər bu Quran haqqında və onun bizim tərəfimizdən olmağında şəkk və şübhəniz olsa, (فَاْتُوا بِسُورَةٍ مِنْ مِثْلِهِ) - bu Quran surələrinə bənzər bir surə də siz gətirin,** (ta ki məlum olsun, bu Quranı Hz. Məhəmməd özündən düzəldib və o, bizim tərəfimizdən deyil). **(وَادْعُوا شُهَدَآءَكُمْ) - çağırın hazır olan məbudlarınızı, (مِنْ دُونِ اللّٰهِ) – Allah-Təaladan başqa olanları (ki, onlara ibadət edirsiniz, ta ki onlar da sizə kömək olub, bəlkə bir Quran surəsinin müqabilində bir şey gətirə biləsiniz). (اِنْ كُنْتُمْ) - əgər "Məhəmməd bu Quranı özündən düzəldib" - kəlamınızda, (صَادِقِينَ) - doğrusunuzsa.** (Hz. Peyğəmbər Allah-Təala tərəfindən bu ayəni müşriklərə oxuyub Quranı inkar etməkdə onlardan dəlil istədi ki, Quranın surələri kimi bir surə gətirib Quranı batil eləsinlər. Əgər onlar qadir olsaydılar, hərçənd bir ayə də olsaydı, gətirib batil edərdilər. Onların aciz olmağı Quranın haqq olmasına böyük dəlildir. Elə ki Quranın müqabilində surə gətirməkdən aciz qaldılar, Allah-Təala da sıradakı ayədə onlara xitab edib buyurur:)

**24) (فَاِنْ لَمْ تَفْعَلُوا) Əgər Quranın müqabilində surə gətirməkdən aciz olsanız (وَلَنْ تَفْعَلُوا) Quranın müqabilində əbədi olaraq surə gətirə bilməyəcəksiniz (فَاتَّقُوا النَّارَ الَّتِي) Bəs Allah Taladan qorxub Quranı inkar etməyin, özünüzü elə bir odun əzabından hifz edin ki, (وَقُودُهَا النَّاسُ وَالْحِجَارَةُ) onun yanacağı insan və daşdır.** (Batil olan məbudlar ki, Allahdan savayı onlara ibadət olunurdu) **Yəni,**

أُعِدَّتْ لِلْكَافِرِينَ ﴿٢٤﴾ وَبَشِّرِ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ اَنَّ لَهُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ كُلَّمَا رُزِقُوا مِنْهَا مِنْ ثَمَرَةٍ رِزْقًا قَالُوا هٰذَا الَّذِي رُزِقْنَا مِنْ قَبْلُ وَاُتُوا بِهٖ مُتَشَابِهًا وَلَهُمْ فِيهَٓا اَزْوَاجٌ مُطَهَّرَةٌ وَهُمْ فِيهَا خَالِدُونَ ﴿٢٥﴾ اِنَّ اللّٰهَ لَا يَسْتَحْيٖٓ اَنْ يَضْرِبَ مَثَلًا مَا بَعُوضَةً فَمَا فَوْقَهَا فَاَمَّا الَّذِينَ اٰمَنُوا

---

**ey müşriklər! Siz ki, Allah Taladan başqa bu cansızlara sitayiş edirsiniz və onlara məhəbbətiniz vardır, axirət əzabında onları sizinlə bir yerə cəm edərəm. O odun yanmağında heç bir şeyə ehtiyac yoxdur. Bəlkə insanın özündən əmələ gələn oddur.** (أُعِدَّتْ) **Bir belə od hazır olunub.** (لِلْكَافِرِينَ) **Quranı inkar edən kafirlərdən ötrü.** (Keçən ayədə kafirlərə əzab vədi verdi. Bundan sonra gələn ayədə isə möminlərə səvab vədi verir.)

**25) (وَبَشِّرِ الَّذِينَ) – müjdə ver** (ey Məhəmməd)**, o şəxslərə ki, (اٰمَنُوا) - iman gətiriblər bu Qurana, (وَعَمِلُوا الصَّالِحَاتِ) - və yaxşı olan əməllər ediblər. (اَنَّ لَهُمْ جَنَّاتٍ) - həqiqətən, Allah-Təala onlardan ötrü axirətdə bağlar hazır edibdir. (تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) - o bağların ağaclarının və qəsrlərinin altından çaylar axır. (كُلَّمَا) – nə zaman ki (رُزِقُوا) - ruzi verilər cənnət əhlinə, (مِنْهَا) - o bağlardan, (مِنْ ثَمَرَةٍ)- bir meyvədən, (رِزْقًا) - bir ruzi, (قَالُوا) - cənnət əhli deyər: (هٰذَا الَّذِي) - bu həmin ruzidir, (رُزِقْنَا) ki, ruzi verildi bizlərə, (مِنْ قَبْلُ)- bundan əvvəl dünyada.** (Yəni axirət meyvələri və ruziləri dünya meyvələri və ruziləri kimi olur, cənnət əhli onları görəndə yadlarına salırlar ki, bunlar həmin ruzilərdir ki, Allah-Təala dünyada onlara bəxş etmişdi. Lakin yeyəndən sonra məlum olur ki, oxşarlıq ancaq onların surətində olub, dadlarında heç bir bənzərlik yoxdur. (Bəli, o, elm ağacıdır ki, ondan oxşar meyvələr hasil olar. Hər biri ruhdan ötrü qida olmaqda o birisinə oxşayar). **(وَاُتُوا بِهٖ مُتَشَابِهًا) - dünya və axirət ruzisi iman əhlinə bir-birinə oxşar şəkildə verilər. (وَلَهُمْ فِيهَٓا اَزْوَاجٌ مُطَهَّرَةٌ)** – (cənnət əhlindən ötrü cənnətdə) **hər bir eyib və çirkinlikdən (hansı ki, dünya qadınlarında olur) təmiz, pak və qüsursuz olan qadınlar vardır. (وَهُمْ) - və cənnət əhli, (فِيهَا) - o cənnətdə, (خَالِدُونَ) - həmişəlik qalıb, nə oradan çıxmaz və nə də ölüm onlara gəlməz.** (Allah-Təala Qurani-Şərifində hörümçək, milçək və qarışqa kimi bəzi zəif heyvanları misal göstərmişdir. Müşrik və yəhudilər bu məsəlin hökmündən qafil olub, qeyd olunan məsəllərə irad tuturdular. Allah-Təala onların iradını rədd etmək üçün bundan sonra gələn ayəni nazil elədi).

**26) (اِنَّ اللّٰهَ) - həqiqətən, Allah-Təala, (لَا يَسْتَحْيٖٓ) - həya etməz, (اَنْ يَضْرِبَ مَثَلًا مَا) - bundan ki, misal versin haqq olan məsəli, (بَعُوضَةً) - ağcaqanad ilə (فَمَا فَوْقَهَا) - bəlkə, ondan da zəif olan heyvanı,** (yəni ey müşriklər, o şəriklər ki, Allah-Təalaya şərik qoşursunuz, ağcaqanad kimi zəif olan heyvanı da yaratmağa qadir deyillər. Bəs niyə onlara sitayiş edirsiniz? Bəs qafil olmayan şəxs qüdrəti olmayan cansız şeyə sitayiş edərmi?) **(فَاَمَّا الَّذِينَ اٰمَنُوا) - amma o şəxslər**

فَيَعْلَمُونَ اَنَّهُ الْحَقُّ مِنْ رَبِّهِمْ ۚ وَاَمَّا الَّذِينَ كَفَرُوا فَيَقُولُونَ مَاذَآ اَرَادَ اللّٰهُ بِهٰذَا مَثَلًا ۘ يُضِلُّ بِه۪ كَث۪يرًا
وَيَهْد۪ي بِه۪ كَث۪يرًاۜ وَمَا يُضِلُّ بِه۪ٓ اِلَّا الْفَاسِق۪ينَ ۙ ﴿٢٦﴾ اَلَّذ۪ينَ يَنْقُضُونَ عَهْدَ اللّٰهِ مِنْ بَعْدِ م۪يثَاقِه۪ۖ
وَيَقْطَعُونَ مَٓا اَمَرَ اللّٰهُ بِه۪ٓ اَنْ يُوصَلَ وَيُفْسِدُونَ فِي الْاَرْضِۜ اُو۬لٰٓئِكَ هُمُ الْخَاسِرُونَ﴿٢٧﴾ كَيْفَ
تَكْفُرُونَ بِاللّٰهِ وَكُنْتُمْ اَمْوَاتًا فَاَحْيَاكُمْۚ ثُمَّ يُم۪يتُكُمْ ثُمَّ يُحْي۪يكُمْ ثُمَّ اِلَيْهِ تُرْجَعُونَ ﴿٢٨﴾

---

**ki, Qurani-Şərifə iman ediblər, (فَيَعْلَمُونَ) – agah olurlar ki, (اَنَّهُ الْحَقُّ) - o məsəl haqdır, (مِنْ رَبِّهِمْ) - onların rəbbi Allah-Təaladan, (وَاَمَّا الَّذِينَ كَفَرُوا) - amma o şəxslər ki, Qurana kafir oldular, (فَيَقُولُونَ) - deyirlər: (مَاذَآ اَرَادَ اللّٰهُ) – Allah-Təala nə istəyibdir, (بِهٰذَا مَثَلًا) - bu zəif olan heyvanları misal çəkməklə?, (يُضِلُّ بِه۪)** - (qeyd olunan məsəllərə irad tutan kafirlərə bu bir cavabdır), **Allah-Təala zəlalətdə qoyar bu misal səbəbilə, (كَث۪يرًا) - çox olan camaatı** (Qurana iman etməyənləri), (وَيَهْد۪ي بِه۪) **və Allah Tala hidayət edər** (Bu misli səbəbinə) (كَث۪يرًا) **Çox olan camaatı** (Qurana iman gətirənləri) **(وَمَا يُضِلُّ بِه۪ٓ) – Allah-Təala bu misal səbəbi ilə** (möminləri) **zəlalətə salmaz, (اِلَّا الْفَاسِق۪ينَ) - ancaq fasiq olan şəxsləri** (zillətə salar).

**27) (اَلَّذ۪ينَ) - qeyd olunan fasiqlərin xüsusiyyətlərindən biri budur ki, (يَنْقُضُونَ) – dəyişdirib pozurlar, (عَهْدَ اللّٰهِ) – Allah-Təalanın əhdini,** (Allah-Təalanın əhdi insana ağıl verib, o ağılla Allah-Təalanı tanıyıb, ona şərik qoşmamaqdan ibarətdir). **(مِنْ بَعْدِ م۪يثَاقِه۪) - o əhdi pozurlar Allah-Təala onu möhkəm eləyəndən sonra,** (yəni kamil bir ağıl verəndən sonra), **(وَيَقْطَعُونَ) - və kəsirlər, (مَٓا اَمَرَ اللّٰهُ بِه۪ٓ اَنْ يُوصَلَ) - o şeyi ki Allah-Təala əmr edibdir, gərək o şey birləşdirilib, kəsilməsin.** (Allah-Təala qohum-əqrəba ziyarətini əmr edibdir. Onlar qohumlarla əlaqəni kəsirlər). **(وَيُفْسِدُونَ فِي الْاَرْضِ) - və fəsad törədirlər yer üzündə.** (Allah-Təalaya asi olub, xalqın iman etməsinə mane olurlar). **(اُو۬لٰٓئِكَ هُمُ الْخَاسِرُونَ) - o fasiqlər dünya və axirətdə özlərinə zərər verənlərdir.** (Hər bir şəxsin əməlinin qarşılığı qiyamət günündə özünə aid olduğu kimi, fasiqlərin əməllərindən də özlərinə zərər gələr).

**28) (كَيْفَ تَكْفُرُونَ بِاللّٰهِ) - necə kafir olursunuz Allah-Təalaya? (وَكُنْتُمْ اَمْوَاتًا) - və halbuki siz ölü idiniz,** (atanızın belində sperma idiniz), **(فَاَحْيَاكُمْ) – Allah-Təala sizi dirildib dünya aləminə gətirdi.** (O vaxt ki atanın belindəki sperma ananın rəhmində yerləşər, Allah-Təalanın təyini ilə ana rəhmində inkişaf edib, müəyyən vaxtda dünya aləminə gələr). **(ثُمَّ يُم۪يتُكُمْ) - o həyatdan sonra da sizi öldürər. (ثُمَّ يُحْي۪يكُمْ) - öldükdən sonra sizi ikinci dəfə dirildər** (qiyamət günündə), **(ثُمَّ اِلَيْهِ) - o haldan sonra Allah-Təalanın tərəfinə, (تُرْجَعُونَ) - haqq-hesabdan ötrü döndərilərsiniz.** (Bu ayə qiyamətin haqq olmasına, insanın öləndən sonra diriləcəyinə dəlildir)**.**

هُوَ الَّذي خَلَقَ لَكُمْ مَا فِي الْاَرْضِ جَميعًا ثُمَّ اسْتَوٰىٓ اِلَى السَّمَآءِ فَسَوّٰيهُنَّ سَبْعَ سَمٰوَاتٍۜ وَهُوَ بِكُلِّ
شَيْءٍ عَليمٌ ۟ ﴿٢٩﴾ وَاِذْ قَالَ رَبُّكَ لِلْمَلٰٓئِكَةِ اِنّي جَاعِلٌ فِي الْاَرْضِ خَليفَةًۜ قَالُوٓا اَتَجْعَلُ فيهَا مَنْ
يُفْسِدُ فيهَا وَيَسْفِكُ الدِّمَآءَۚ وَنَحْنُ نُسَبِّحُ بِحَمْدِكَ وَنُقَدِّسُ لَكَۜ قَالَ اِنّيٓ اَعْلَمُ مَا لَا تَعْلَمُونَ ﴿٣٠﴾

---

**29) (هُوَ الَّذي) - o Allah-Təala ki, onu inkar edirsiniz, (خَلَقَ لَكُمْ مَا فِي الْاَرْضِ جَميعًا) - yeri və yerdə olan hər bir şeyi sizdən ötrü yaradıbdır. (ثُمَّ اسْتَوٰىٓ اِلَى السَّمَآءِ) Allah yeri xəlq edəndən sonra səmanı xəlq etmək istədi. (فَسَوّٰيهُنَّ) – səmaları yaradıb, son dərəcə möhkəm şəkildə, (سَبْعَ سَمٰوَاتٍ) - yeddi səma yaratdı. (وَهُوَ بِكُلِّ شَيْءٍ عَليمٌ) – hər şeyə agah olan Allah-Təaladır.** (Səma bizim yuxarı tərəfimizə deyilir. Hava qat-qat olub, bəzən sıx dumanlı və bəzən açıq olması cəhətdən mümkündür ki, burada yeddi qat səma nəzərdə tutulsun. Ən doğrusunu Allah bilir).

**30) (وَاِذْ) - yadına sal, xatırla** (ey Məhəmməd), **o zaman ki, (قَالَ رَبُّكَ لِلْمَلٰٓئِكَةِ) – sənin rəbbin Allah-Təala mələklərə* dedi:** (yer üzündə olan mələklərə),

*(***Qeyd:** *Allah-Təala bu ayədə Adəm babanın yaradılışını bəyan edir. Adəm Məkkə ilə Taif arasında xanımı Həvva ilə birlikdə torpaqdan yaradılıbdır. Allah-Təalanın sual-cavab şəklində söhbət etdiyi mələklər isə yer üzündə sakin olublar. Mələklər də yer üzündə yaşayan bir növ məxluq idi. Necə ki, cin tayfası yaşayırdı, səmada olan məxluqa da mələk deyilir. Amma Hz. Adəm əhvalatında qeyd olunan mələklər həmin yer üzündə olan mələklərdir. Ola bilər ki, bu söhbət Allah-Təala ilə mələklər arasında olsun. Adəmin vücuduna əmanət qoyulan elm, qabiliyyət və onun tədricən zühura gəlməsi belə sual və cavabı lazım edibdir. Doğrusunu Allah bilir).*

**(اِنّي) - həqiqətən, mən (جَاعِلٌ) – yaradacağam, (فِي الْاَرْضِ) - yer üzündə, (خَليفَةً) - özümdən ötrü bir varis, (قَالُوٓا اَتَجْعَلُ) – mələklər dedilər: bəs yaradırsan, (فيهَا) - yer üzündə, (مَنْ) - bir şəxs ki, (يُفْسِدُ فيهَا) - yer üzündə fəsad törədsin, (وَيَسْفِكُ الدِّمَآءَ) - və qanlar töksün?** (Yəni Adəm övladından bu işlər törəyəcəkdir). **(وَنَحْنُ) - halbuki biz mələklər, (نُسَبِّحُ بِحَمْدِكَ) - sənə həmd etməklə səni zikr edirik. (وَنُقَدِّسُ لَكَ) - və sənə layiq olmayan hər bir eyib və nöqsandan səni pak və qüsursuz sayırıq. Daha bizdən başqa, fəsad törədən məxluqu yaratmaq niyə lazımdır? (قَالَ) – Allah-Təala onlara cavabında buyurdu: (اِنّيٓ اَعْلَمُ مَا) - həqiqətən, mən o şeyə agaham ki, (لَا تَعْلَمُونَ) - siz ona agah deyilsiniz, (yəni siz mələklər bu insanın zahirini qan tökən və fəsad törədən görüb, onun yaradılmasına razı olmursunuz, amma bu insanın yaradılışında nə hikmətlər vardır və nə təəccüblü məxluqdur, ondan qafilsiniz?** (Ondan sonra Allah-Təala Adəmi yaradıb, onun fəzilətini mələklərə bəyan etdi ki, bu Adəmdə və onun övladlarında nə qədər fəzilət vardır və onlardan nə qədər təəccüblü işlər meydana gələcəkdir, lakin siz mələklər işin həqiqətinə agah deyilsiniz. O səbəbdən Adəmin yaradılmasına mane olursunuz. Necə ki, gələn ayədə bəyan buyurur).

وَعَلَّمَ اٰدَمَ الْاَسْمَآءَ كُلَّهَا ثُمَّ عَرَضَهُمْ عَلَى الْمَلٰٓئِكَةِ فَقَالَ اَنْبِؤُنِي بِاَسْمَآءِ هٰؤُلَٓاءِ اِنْ كُنْتُمْ صَادِقِينَ
﴿٣١﴾ قَالُوا سُبْحَانَكَ لَا عِلْمَ لَنَآ اِلَّا مَا عَلَّمْتَنَاۜ اِنَّكَ اَنْتَ الْعَلِيمُ الْحَكِيمُ ﴿٣٢﴾ قَالَ يَآ اٰدَمُ اَنْبِئْهُمْ
بِاَسْمَآئِهِمْۚ فَلَمَّآ اَنْبَاَهُمْ بِاَسْمَآئِهِمْۙ قَالَ اَلَمْ اَقُلْ لَكُمْ اِنّيٓ اَعْلَمُ غَيْبَ السَّمٰوَاتِ وَالْاَرْضِ وَاَعْلَمُ مَا تُبْدُونَ

---

**31) (وَعَلَّمَ اٰدَمَ الْاَسْمَآءَ كُلَّهَا) – Allah-Təala dünyada olan və olacaq bütün şeylərin adlarını Adəmə öyrətdi.* (ثُمَّ) - bütün şeylərin adlarını Adəmə öyrədəndən sonra, (عَرَضَهُمْ عَلَى الْمَلٰٓئِكَةِ) - həmin şeyləri mələklərə göstərdi. (فَقَالَ) – Allah-Təala mələklərə dedi: (اَنْبِؤُنِي بِاَسْمَآءِ هٰؤُلَٓاءِ) - bu şeylərin adlarını mənə xəbər verin. (اِنْ كُنْتُمْ) - əgər "Adəmin vücudundan şərdən başqa heç bir şey meydana gəlməz" - sözünüzdə, (صَادِقِينَ) doğrusunuzsa.**

*(****Qeyd:*** *Bu ayə elmin fəzilətinə və elmin insana hər bir şeydən daha əvvəl lazım olmasına işarə edir, çünki Allah-Təala Adəm babanı yaratdı, ona məişəti üçün lazım olan yemək, içmək, libas və sair şeylərin hamısından əvvəl Adəmə elm öyrətdi və Adəmlə mələk hekayəsinin Quranda qeyd edilməsinin məqsədi elm yolunu bizə bildirməkdir. Yəni elmə mane olan şeyləri gərək dəlil üzrə dəf edəsiniz. Necə ki, mələklər Adəmin yaradılışına mane olmaq istəsələr də, iddiaları dəlillə dəf edildi. Demək, insanın yaradılışındakı əsl məqsəd elmdir. Adəm babanın şərəfi elm səbəbinə zahir olduğu üçün onun övladları da gərək ona tabe olub elm öyrənməkdən qafil olmasınlar).*

**32) (قَالُوا) - mələklər aciz olduqlarını iqrar edib dedilər: (سُبْحَانَكَ) - ilahi, hər bir eyib və nöqsandan pak və qüsursuzsan, (لَا عِلْمَ لَنَآ) - bizim elmimiz yoxdur, (اِلَّا مَا عَلَّمْتَنَا) - ancaq o elm ki, sən bizə öyrətmisən (ancaq bu, var), (اِنَّكَ اَنْتَ الْعَلِيمُ الْحَكِيمُ) - həqiqətən, əlbəttə, sənsən hər bir şeyə agah olan və hikmət sahibisən, hər bir şey səndən hikmət üzrə meydana gələr, səndən boş və əbəs iş meydana gəlməz.**

**33) (قَالَ يَآ اٰدَمُ) - Allah-Təala Adəmə xitab edib buyurdu: "Ey Adəm, (اَنْبِئْهُمْ) - xəbər ver mələklərə, (بِاَسْمَآئِهِمْ) – o şeylərin adlarını ki, sənə öyrətdik,** (Hz. Adəm Allah-Təalanın əmri ilə o şeylərin adlarını mələklərə xəbər* verdi.

*(****Qeyd:*** *Sual: bu elmlər ki, Allah-Təala Adəmə öyrətmişdi, əgər mələklərə öyrətsəydi, onlar da Adəm kimi o şeylərin adlarına agah olardılar, bunun Adəm üçün nə fəziləti var? Cavab: belədir, lakin mələklər torpaqdan yaradılan Adəmin elmə qabil olmağını inkar edirdilər, Allah-Təala Adəmə elm öyrətməklə mələklərə göstərir ki, bu Adəm hər bir elmə qabildir, onun elmə qabil olmağını inkar etməyiniz yersizdir).*

**(فَلَمَّآ اَنْبَاَهُمْ بِاَسْمَآئِهِمْ) - Nə vaxt ki, adları onlara xəbər verdi mələklər aciz qaldılar. (قَالَ) - Allah-Təala mələklərə dedi: (اَلَمْ اَقُلْ لَكُمْ) – bəs sizə demədim ki, (اِنّيٓ اَعْلَمُ) - həqiqətən, mən bilirəm, (غَيْبَ السَّمٰوَاتِ وَالْاَرْضِ) - səmaların və yerin qeyb olan işlərini, (وَاَعْلَمُ) - və yenə bilirəm, (مَا تُبْدُونَ) - o şeyi ki siz onu aşkar edirsiniz,** (yəni ey sizlər, aşkar dediniz ki, nədən ötrü Adəmi yer üzündə ya-

وَمَا كُنْتُمْ تَكْتُمُونَ ﴿٣٣﴾ وَاِذْ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ فَسَجَدُوٓا اِلَّآ اِبْلِيسَۜ اَبٰى وَاسْتَكْبَرَ وَكَانَ مِنَ الْكَافِرِينَ ﴿٣٤﴾ وَقُلْنَا يَآ اٰدَمُ اسْكُنْ اَنْتَ وَزَوْجُكَ الْجَنَّةَ وَكُلَا مِنْهَا رَغَدًا حَيْثُ شِئْتُمَا وَلَا تَقْرَبَا هٰذِهِ الشَّجَرَةَ فَتَكُونَا مِنَ الظَّالِمِينَ ﴿٣٥﴾

---

radırsınız?) **(وَمَا كُنْتُمْ تَكْتُمُونَ) - və mən o şeyi bilirəm ki, siz onu gizlədirsiniz.** (Yəni o şeyi ki demişdiniz - Allah-Təala necə bir məxluq yaradacaqdır ki, bizdən əziz, möhtərəm və elmə qabil elm olsun? İndi sizə məlum oldu ki, bu torpaqdan yaradılan məxluq elmə qabildir, halbuki siz onu inkar edirdiniz. Çünki işin sonuna agah deyildiniz).

**34) (وَاِذْ) - yadına sal, xatırla** (ey Məhəmməd), **o zaman ki, (قُلْنَا لِلْمَلٰٓئِكَةِ) - yer üzündə sakin olan mələklərə dedik: (اسْجُدُوا لِاٰدَمَ) - Adəmə səcdə eləyin.** (Adəmin torpağı siz mələklərin nəzərində o zaman zəlil göründü. İndi ki, elm səbəbinə onun fəziləti sizə aşkar oldu, gərək ona səcdə eləyəsiniz). **(فَسَجَدُوٓا) - bütün mələklər Adəmə səcdə elədilər. (اِلَّآ اِبْلِيسَ) - ancaq şeytan təkəbbür və qürurundan səcdə etmədi. (اَبٰى وَاسْتَكْبَرَ) - səcdə etməkdən uzaqlaşıb təkəbbürləndi. (وَكَانَ مِنَ الْكَافِرِينَ) - Allah-Təalanın itaətindən çıxan kafirlərdən oldu.** (Hər bir şeydən əvvəl insana lazım olan şey elmdir və bu səbəbdən Allah-Təala ilk insana hər bir şeydən qabaq elm öyrətdi. Ondan sonra Adəmin qidaya ehtiyacı olub, qidasız yaşamaq mümkün olmadığına görə, Allah-Təala Adəm və xanımı Həvvanın qidalanması üçün bir yer təyin edib, onlara o yerdə məskun olub qidalanmağı əmr etdi. Necə ki, gələn ayədə xəbər verir. İnsan anadan olan kimi hər bir şeydən əvvəl ona elmin lazım olmasında heç bir şəkk və şübhə yoxdur. Uşaq anadan olan kimi gərək ona əvvəlcə süd içmək şəkli öyrədilsin. Ondan sonra böyüdükcə din və dünya işləri gərək ona öyrədilsin. Çünki dünyadan köçüb qəbrə daxil olana kimi insanın elmə ehtiyacı var. Hz. Peyğəmbərdən nəql olunan hədisin məzmunu belədir, buyurur: "Beşikdən qəbrə kimi elm tələb edin" (Allahın peyğəmbəri (s.ə.s) doğru buyurub).

**35) (وَقُلْنَا يَآ اٰدَمُ) - Adəmə dedik: "Ey Adəm, (اسْكُنْ اَنْتَ) - sakin və rahat olub istirahət et, sən özün (وَزَوْجُكَ الْجَنَّةَ) - və xanımın* Həvva o bağda.** (O bağ yer üzündə olan bağlardan biri idi, Adəm Həvva ilə orada məskun oldular). (Ola bilər ki, o bağ Ərəbistan yarımadasında, Taifdə olsun). **(وَكُلَا مِنْهَا رَغَدًا) - asanlıqla və rahatlıqla o bağın meyvəsindən yeməklə məşğul olun, (حَيْثُ شِئْتُمَا) - o bağın hər bir tərəfində hansı meyvəsindən istəsəniz, (وَلَا تَقْرَبَا) – və yaxınlaşmayın, (هٰذِهِ الشَّجَرَةَ) - bu ağaca,** (üzüm ağacına)**, onun meyvəsindən yeməyin, əgər onun meyvəsindən yesəniz, (فَتَكُونَا) - o vaxt olarsınız, (مِنَ الظَّالِمِينَ) - zalım olan şəxslərdən, (çünki Allaha itaətdən çıxmaq Ona zülmdür və bütün zülmlərin ən böyüyü Allah-Təalaya zülm etməkdir).**

فَاَزَلَّهُمَا الشَّيْطَانُ عَنْهَا فَاَخْرَجَهُمَا مِمَّا كَانَا فيهِ ۖ وَقُلْنَا اهْبِطُوا بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ ۚ وَلَكُمْ فِي
الْاَرْضِ مُسْتَقَرٌّ وَمَتَاعٌ اِلٰى حِينٍ ﴿٣٦﴾ فَتَلَقّٰى اٰدَمُ مِنْ رَبِّهِ كَلِمَاتٍ فَتَابَ عَلَيْهِ ۗ اِنَّهُ هُوَ التَّوَّابُ
الرَّحِيمُ ﴿٣٧﴾ قُلْنَا اهْبِطُوا مِنْهَا جَمِيعًا ۚ فَاِمَّا يَاْتِيَنَّكُمْ مِنّي هُدًى فَمَنْ تَبِعَ هُدَايَ

---

*(*Qeyd: Allah-Təala Adəm və Həvvanı torpaqdan yaradıbdır, hədisdə deyilir ki, Allah-Təala Həvvanı Adəmin sol qabırğa sümüyündən yaratmışdır. (Buxari, Ənbiya, 1/ Nikah, 79.) Hədisdən məqsəd budur ki, Allah-Təala Həvvanı Adəmin sol tərəfində olan torpaqdan və o tərəfə bitişik olan torpaqdan yaradıb. Adəm və Həvva hər ikisi birlikdə torpaqdan yaranıb, ayağa qalxdılar).*

**36) (فَاَزَلَّهُمَا الشَّيْطَانُ عَنْهَا) - şeytan Adəmlə Həvvanı** (onlara qadağan edilən o ağacın meyvəsindən yemək səbəbilə) **günaha saldı. (فَاَخْرَجَهُمَا مِمَّا كَانَا فِيهِ) – və şeytan Adəmlə Həvvanı içində olduqları nemətlərdən çıxarıb, günaha saldı. (وَقُلْنَا اهْبِطُوا) - ağacın meyvəsindən yeyəndən sonra Adəm ilə Həvvaya dedik: bu cənnətdən çıxıb yer üzünə enin. (بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ) – elə bir halda ki, sizin övladlarınız bir-birinə düşmən olacaqdır. (وَلَكُمْ فِي الْاَرْضِ) - yer üzündə sizdən ötrü olacaqdır, (مُسْتَقَرٌّ) - məkan və məskən, (وَمَتَاعٌ) - yerdə olan nemətlərdən ləzzət almaq, (اِلٰى حِينٍ) - ta** (müəyyən) **bir zamana kimi,** (yəni hər bir şəxs dünyada ömür sürdüyü qədər ondan faydalanacaqdır). (elə ki Allah-Təala Adəmlə Həvvanı elədikləri xəta səbəbi ilə cənnətdən çıxartdı, bir müddət ağlayıb tövbə elədilər, Allah-Təala onların tövbəsini qəbul elədi, necə ki, gələn ayədə buyurur).

**37) (فَتَلَقّٰى اٰدَمُ) - Adəm tövbə məqamında öyrənib aldı, (مِنْ رَبِّهِ) - öz rəbbi Allah-Təaladan, (كَلِمَاتٍ) - bir neçə kəlmə,** (bundan sonra qeyd olunan kəlmələri Allah-Təala Adəmə öyrətdi, dedi: "Ey Adəm, bu kəlmələri deyib, günahını etiraf et ki, tövbən qəbul olunsun, elə ki Adəmlə Həvva o kəlmələri dedi, Allah-Təala da onların tövbəsini qəbul elədi. Adəmlə Həvvanın öz xətalarını etiraf edib dediyi kəlmələr bunlardır:) **"Ey bizim rəbbimiz, özümüzə zülm eləmişik, əgər bizi bağışlayıb rəhm etməsən, hər halda dünya və axirətdə ziyankarlardan olarıq".** (Adəmin tövbə edib öz xətasını etiraf etməsi Allah-Təalanın öyrətməsi ilə olmuşdur). **(فَتَابَ عَلَيْهِ) - Adəm o kəlmələri dedi, Allah-Təala da onun tövbəsini qəbul elədi. (اِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ) - həqiqətən, Allah-Təala öz bəndələrinə rəhm edib, onların tövbəsini qəbul edəndir.** (Qadın kişiyə tabe olduğu üçün Həvvanın tövbəsi ayrıca qeyd olunmadı).

**38) (قُلْنَا اهْبِطُوا مِنْهَا) - biz Adəmlə Həvvaya dedik: cənnətdən çıxıb yer üzünə enin, (جَمِيعًا) - özünüz və bütün övladlarınız gərək yerdə məskun olasınız. (فَاِمَّا يَاْتِيَنَّكُمْ مِنّي هُدًى) - siz yerdə məskun olandan sonra əgər mənim tərəfimdən sizə bir hidayət edən** (peyğəmbər və kitab) **gələndə, (فَمَنْ تَبِعَ هُدَايَ) –kim ki, mənim tərəfimdən gələn hidayət yolunu göstərənə tabe olub**

فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٣٨﴾ وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَآ اُولٰٓئِكَ اَصْحَابُ النَّارِۚ
هُمْ فِيهَا خَالِدُونَ ﴿٣٩﴾ يَا بَنِيٓ اِسْرَآءِيلَ اذْكُرُوا نِعْمَتِيَ الَّتِيٓ اَنْعَمْتُ عَلَيْكُمْ وَاَوْفُوا بِعَهْدِيٓ اُوفِ
بِعَهْدِكُمْ وَاِيَّايَ فَارْهَبُونِ ﴿٤٠﴾ وَاٰمِنُوا بِمَآ اَنْزَلْتُ مُصَدِّقًا لِمَا مَعَكُمْ وَلَا تَكُونُوٓا اَوَّلَ كَافِرٍ بِهٖۖ وَلَا
تَشْتَرُوا بِاٰيَاتِي ثَمَنًا قَلِيلًاۘ

---

**onun dediklərini qəbul eləsə, (فَلَا خَوْفٌ عَلَيْهِمْ) - o şəxslərə axirət əzabından heç bir qorxu yoxdur, (وَلَا هُمْ يَحْزَنُونَ) - qiyamət günündə hüznlü və qəmgin olmazlar.**

**39) (وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَآ) - o şəxslər ki, kafir olub bizim tərəfimizdən gələn peyğəmbərləri və möcüzələri təkzib eləyər, (اُولٰٓئِكَ اَصْحَابُ النَّارِ) - onlardır od yoldaşları,** (cəhənnəm odunda olanlar), **(هُمْ فِيهَا خَالِدُونَ) - onlardır od əzabında həmişəlik qalanlar.** (Bundan sonra qeyd olunan bir neçə ayə uca peyğəmbərin zamanında yaşayan yəhudilərə xitabdır).

**40) (يَا بَنِيٓ اِسْرَآءِيلَ) - ey Yaqub oğulları, (Yaqub peyğəmbərin adı yəhudi dilində İsraildir, ərəblər ona Yaqub deyirlər). (اذْكُرُوا نِعْمَتِيَ الَّتِيٓ اَنْعَمْتُ عَلَيْكُمْ) - sizə verdiyim nemətlərimi yadınıza salıb, unutmayın.** (Sizə Musa kimi bir peyğəmbər göndərib ata-babalarınızı dənizdən xilas edib, Fironu suda qərq elədim ki, onların nəslindən olan sizlər sağ qalıb dünyada yaşayasınız. Bəs bu nemətləri yadınıza salıb, şükür etməzsinizmi?) **(وَاَوْفُوا بِعَهْدِيٓ) - və vəfa eləyin mənim əhdimə,** (hansı ki, sizə ağıl vermişəm. Gərək o ağıl ilə* məni tanıyıb, mənə itaət eləyəsiniz). **(اُوفِ بِعَهْدِكُمْ) - mən də sizin əhdinizə vəfa edərəm,** (sizə iman etmənizin müqabilində yaxşı, gözəl mükafatlar bəxş edərəm). **(وَاِيَّايَ فَارْهَبُونِ) - əlbəttə, mənim qəhr, qəzəbimdən qorxub, məndən başqasından qorxmayın.**

*(*Qeyd:* **Qeyd:** *Allah-Təala insana ağıl verib ki, insan o ağıl ilə gərək Allah-Təalanı tanıyıb, ona iman eləsin. Hərçənd peyğəmbər olmasa da, Allah-Təalanı tanımaqda təkcə ağıl kifayət edər. Heç bir peyğəmbər insanlara deməyib ki, ey insanlar, deyin ki, Allah-Təala var, əksinə, hansı peyğəmbər gəlibsə, insanlara bunu deyib: deyin ki, Allah-Təala birdir və şəriki yoxdur. Peyğəmbər insanları qəflətdən oyadıb, şirki yox edib, sair ehkamı vəz etməkdən ötrü lazımdır. Amma təkcə Allah-Təalanın varlığını iqrar etməkdə ağıl kifayət edib peyğəmbər lazım deyildir və bu qayə üçün peyğəmbər gəlməyib. Haqqa dəvət olunmayan ümmətlərə Allah-Təalanın varlığını iqrar etmədikləri, ya da Ona şərik qoşduqları üçün əzab olunub, sair ehkamdan ötrü əzab edilməyəcəkdir).*

**41) (وَاٰمِنُوا) - iman gətirin ey bəni-İsrail, (بِمَآ اَنْزَلْتُ) - o Qurana ki, onu Hz. Məhəmmədə nazil etmişəm, (مُصَدِّقًا لِمَا مَعَكُمْ) - təsdiq eləyəndir bu Quran sizdə olan o kitabı** (Tövratı). **(وَلَا تَكُونُوٓا اَوَّلَ كَافِرٍ بِهٖ) – “əhli-kitab” olan siz yəhudilər bu Quranı ilk inkar edən olmayın. (وَلَا تَشْتَرُوا بِاٰيَاتِي ثَمَنًا قَلِيلًا) -**

وَاِيَّايَ فَاتَّقُونِ ﴿٤١﴾ وَلَا تَلْبِسُوا الْحَقَّ بِالْبَاطِلِ وَتَكْتُمُوا الْحَقَّ وَاَنْتُمْ تَعْلَمُونَ ﴿٤٢﴾

---

**mənim Tövratda qeyd olunan ayə və ehkamımı dəyişdirib, onun əvəzində az olan qiymətlə dünya* malını almayın. (وَاِيَّايَ فَاتَّقُونِ) - əlbəttə, məndən qorxun, məndən başqasından qorxmayın.**

*(*__Qeyd:__ Yəhudi üləmaları insanlardan bir şeylər alıb onun əvəzində Tövratın ehkamını dəyişdirib, onların istəyinə görə təlim edirdilər. Hərçənd Allah-Təala bu ayədə zahirdə yəhudi üləmalarına belə bir qəbih əməli qadağan edir, amma həqiqətən, bu mübarək kəlamın bir tərəfi bizlərə aid olub, bizim islam üləmalarını xəbərdar etməkdir ki, siz də yəhudi üləmaları kimi dünya malının qarşılığında Qurani-Şərifin ayə və ehkamını dəyişdirməyin. (Müəllif deyir:) belə bir qəbih olan əməli islam üləmasına isnad etmək olarmı? Allah mühafizə etsin ki, belə bir çirkin əməl islam üləmasından meydana gəlsin, baxıb görün, hansı hökmü və hansı ayəni dəyişdiriblər. Məsələn, evli qadının miras alması barəsində Nisa surəsində varid olan ayəni dəyişdiriblər. Ancaq Allah-Təala buyurub ki, ərin övladı olmayan surətdə xanım gərək onun bütün miras buraxdığının 4-də bir hissəsini alsın. (Nisa 4/12) İslam üləmalarından bəzisi deyibdir: bu hökm belə deyil, əksinə, xanımın alacağı miras daşınan və daşınmaz əmlaka, binalara məxsusdur, ərazidən miras almaları qadağandır, ya da ki, bir qızın, ya da qızların miras alması xüsusunda gələn Nisa surəsindəki ayə (Nisa 4/11) haqda xətalı fitva veriblər. Məsələn, Allah-Təala buyurub ki, varis bir nəfər qız olanda malın yarısına malik olur. İki qız və ikidən yuxarı olanda üçdə ikisinə varisdirlər. Ancaq bunun müqabilində islam üləmasından bəzisi deyir ki, yox, belə deyil, bəlkə hər iki surətdə bütün mala varisdirlər. Ya da ki, dəstəmaz barəsində Maidə surəsində varid olan məsh ayəsini dəyişdiriblər. Allah-Təala mübarək kəlamında dəstəmaz zamanı bizə ayaqları məsh eləməyi əmr edir, bunun müqabilində islam üləması başı məsh etməyi qəbul edib, ayaqların barəsindəki "ərcülə" kəlməsini qüsl ayəsinə isnad eləyib, ayaqların qüsl edilməsini hökm edirlər. Ya da ki, cümə namazının vacib olması barəsində təkidlə varid olan ayəni dəyişdiriblər. Halbuki Allah-Təala ayədə cümə namazını bizə şərtsiz vacib eləyib, ancaq islam üləmasından bəziləri onun vacib olmasını imamın olması şərtinə bağlayıb, imam qeyb olduğu dövrdə bu namazı qılmanın haram olması hökmünü veriblər. Ya da ki, zinakar qadınlarla nigahlanmağı mömin şəxslərə haram olması haqqında (Nur 4/3) xətalı fitva verirlər, halbuki Allah-Təala açıq-aydın şəkildə zinakar qadınlarla nigahlanmağı möminlərə haram edib. Ancaq islam üləmasından bəzisi bunun müqabilində deyirlər: yox, haram deyil, bəlkə zinakar qadınlarla nikahlanmaq məkruhdur (caiz deyil) və eynilə bundan başqa ayələr də var ki, onların hamısını qeyd etmək uzunçuluq olar. Bunların hansı birini islam üləması dəyişdirib? Yox, onlara bunu isnad etmək xəta və böhtandır. Ola bilər ki, fiqh kitablarında katiblərin səhvi olsun. (Görəsən, bu qədər dəyişiklik ki, Qurani-Şərifin ehkamında edilib, hamısı katiblərin səhvidir? Allah onların etdiklərinə agahdır).*

**42) (وَلَا تَلْبِسُوا الْحَقَّ بِالْبَاطِلِ) - Tövratın haqq olan sözlərinə özünüzün düzəltdiyiniz batil sözləri geyindirməyin. (وَتَكْتُمُوا الْحَقَّ وَاَنْتُمْ تَعْلَمُونَ) - və halbuki siz özünüz agahsınız ki, haqqa batil libasını geyindirib, batili haqq surətində zahir edib, haqqı gizlədirsiniz.**

وَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ وَارْكَعُوا مَعَ الرَّاكِعِينَ ﴿٤٣﴾ اَتَاْمُرُونَ النَّاسَ بِالْبِرِّ وَتَنْسَوْنَ اَنْفُسَكُمْ
وَاَنْتُمْ تَتْلُونَ الْكِتَابَ ؕ اَفَلَا تَعْقِلُونَ ﴿٤٤﴾ وَاسْتَعِينُوا بِالصَّبْرِ وَالصَّلٰوةِ ۜ وَاِنَّهَا لَكَبِيرَةٌ اِلَّا عَلَى
الْخَاشِعِينَ ۙ ﴿٤٥﴾ اَلَّذِينَ يَظُنُّونَ اَنَّهُمْ مُلَاقُوا رَبِّهِمْ وَاَنَّهُمْ اِلَيْهِ رَاجِعُونَ ۟ ﴿٤٦﴾ يَا بَنِيٓ اِسْرَآءِيلَ اذْكُرُوا
نِعْمَتِيَ الَّتِيٓ اَنْعَمْتُ عَلَيْكُمْ وَاَنِّي

---

**43) (وَاَقِيمُوا الصَّلٰوةَ) - ey bəni-İsrail, islam dinində vacib olan namazı qılın. (وَاٰتُوا الزَّكٰوةَ) –islam dinində vacib olan zəkatı da verin. (وَارْكَعُوا مَعَ الرَّاكِعِينَ) - rüku edib namaz qılan müsəlmanlarla birlikdə namaz qılıb rüku eləyin,** (yəni namazı gərək camaatla birlikdə qılasınız).

**44) (اَتَاْمُرُونَ النَّاسَ) -** (bu ayə yəhudi üləmasına xitabdır), **ey yəhudi üləması, bəs xalqa əmr edirsiniz, (بِالْبِرِّ) - yaxşı əməlləri, (وَتَنْسَوْنَ) – və yaddan çıxarırsınız, (اَنْفُسَكُمْ) – özünüzə nəsihət edib yaxşı əməllərə əmr etməyi? Halbuki hər bir yaxşı əməldə gərək özünüzü öndə tutasınız. Siz bunun xilafını edirsiniz. (وَاَنْتُمْ تَتْلُونَ الْكِتَابَ) - halbuki siz Tövratı oxuyursunuz, pis əməl eləyib, başqalarına yaxşı əməli əmr edənlərin cəzası Tövratda qeyd olunubdur. (اَفَلَا تَعْقِلُونَ) – bəs Allah-Təalanın sizə bəxş elədiyi ağıl ilə rəftar eləyib, bunun qəbahətini dərk eləmirsiniz ki, başqalarına yaxşı əməli əmr edib, özünüzün pis əməl etməniz nə qədər çirkindir? Bir şəxs ki, adını ağıllı qoyub, bu işin qəbahətini dərk etməsin, ağılsızla eyni səviyyədədir.**

**45) (وَاسْتَعِينُوا بِالصَّبْرِ وَالصَّلٰوةِ) –** (ey bəni-İsrail), **hər bir müsibət və məşəqqətlərə səbir eləyib, namaz qılmaqla Allah-Təaladan yardım istəyin. (وَاِنَّهَا لَكَبِيرَةٌ) - həqiqətən, namaz çox böyük və ağırdır.** (İnsanlar namaz qılmaqdan çəkinərlər), **(اِلَّا عَلَى الْخَاشِعِينَ) - ancaq Allah-Təalanın əmrinə itaət eləyib, Onun qorxusundan qəlbləri və əzaları rahat olub, ilahi əmrə xilaf əməl etməyən şəxslər namazı tərk etməzlər.** (Namaz dinin sütunudur, çünki qulluq şüarıdır və imana səbəbdir. Bəndə ilə xaliq arasında vasitəçi olan islam dininin peyğəmbəri Hz. Məhəmməd ibn Abdullah (s.ə.s), həmişə namaz qılıb, onu tərk etməyib. Buna görə də, hər bir müsəlman şəxsə lazımdır ki, bu əzəmətli ibadəti tərk etməsin, çünki onun tərk edilməsində bir çox fəsadlar vardır).

**46) (اَلَّذِينَ) - o namaz qılan şəxslərin xüsusiyyətləri budur, (يَظُنُّونَ اَنَّهُمْ مُلَاقُوا رَبِّهِمْ) - öz rəbləri Allah-Təalanın rəhməti ilə qarşılaşacaqlarını zənn edərək fəzilətli olmaqdan ötrü namaz qılarlar.** (Yəni Allahın rəhməti ilə qarşılaşacaqlarını qəti biləcək səviyyəyə çatmasalar da, bu gümanları ilə yetinib, namaz qılarlar). **(وَاَنَّهُمْ اِلَيْهِ رَاجِعُونَ) - o namaz qılanlar, əlbəttə, öləndən sonra Allah-Təalanın tərəfinə qayıdacaqlarını düşünərlər.**

**47) (يَا بَنِيٓ اِسْرَآءِيلَ) - ey İsrail oğulları, (اذْكُرُوا نِعْمَتِيَ الَّتِيٓ اَنْعَمْتُ عَلَيْكُمْ) - sizə verdiyim nemətlərimi yadınıza salıb unutmayın. (وَاَنِّي) - və həqiqətən, mən**

فَضَّلْتُكُمْ عَلَى الْعَالَمِينَ ﴿٤٧﴾ وَاتَّقُوا يَوْمًا لَا تَجْزِي نَفْسٌ عَنْ نَفْسٍ شَيْئًا وَلَا يُقْبَلُ مِنْهَا شَفَاعَةٌ وَلَا
يُؤْخَذُ مِنْهَا عَدْلٌ وَلَا هُمْ يُنْصَرُونَ ﴿٤٨﴾ وَاِذْ نَجَّيْنَاكُمْ مِنْ اٰلِ فِرْعَوْنَ يَسُومُونَكُمْ سُوٓءَ الْعَذَابِ يُذَبِّحُونَ
اَبْنَآءَكُمْ وَيَسْتَحْيُونَ نِسَآءَكُمْ وَفِي ذٰلِكُمْ بَلَآءٌ مِنْ رَبِّكُمْ عَظِيمٌ ﴿٤٩﴾ وَاِذْ فَرَقْنَا بِكُمُ الْبَحْرَ فَاَنْجَيْنَاكُمْ

---

**ki, varam, (فَضَّلْتُكُمْ عَلَى الْعَالَمِينَ) - sizin ata-babalarınızı öz aləmlərində olan bütün məxluqata üstün etmişdim.** (Bəni-İsraili üstün etmək onlardan peyğəmbərlər göndərib və onları Firondan xilas edib, Fironu suda qərq etməkdən ibarətdir və bundan başqa olan fəzilətləri də hər biri öz məqamında qeyd olunacaqdır).

**48) (وَاتَّقُوا)** – (ey bəni-İsrail), **qorxub özünüzü çəkindirin, (يَوْمًا) - o günün əzabından ki,** (qiyamət günü), **(لَا تَجْزِي نَفْسٌ عَنْ نَفْسٍ شَيْئًا) - heç kim başqasının əvəzinə onun haqqından bir şey verə bilməz. (وَلَا يُقْبَلُ مِنْهَا شَفَاعَةٌ) O nəfsdən ötrü bir şəfaət edənin şəfaəti qəbul olunmaz (وَلَا يُؤْخَذُ مِنْهَا عَدْلٌ)- və ondan heç bir şeyin əvəzi qəbul olunmaz,** (yəni qiyamət günündə heç bir günahkar bir başqasının əvəzinə nə qəbul edilər, nə də şəfaət (bağışlanma diləmək) eləyə bilər). **(وَلَا هُمْ يُنْصَرُونَ) - və o günahkar olan şəxslərə qiyamət günündə kömək edilən deyil.** (Yəni heç kim onlara kömək eləyə bilməz. Firon Misir padşahlarının ləqəbidir, necə ki, ərəblər İran şahına kisra və Bizans sultanına qeysər deyirdilər, Misir padşahlarına da firon deyirdilər. Misirdə olan kahin və falçılar firona xəbər verdilər ki, bəni-İsrail camaatından bir şəxs anadan olacaq və sənin səltənətin onun vasitəsilə məhv olacaqdır. O ağılsız da hökm verdi ki, bəni-İsraildə anadan olan bütün oğlan uşaqlarını qətl etsinlər. Bundan qafil idi ki, Allah-Təalanın hökmü, əlbəttə, vaqe olacaqdır. Necə ki, vaqe oldu. Hz. Musa bəni-İsrail tayfasının içində dünyaya gəlib, fironun Misirdəki səltənəti də məhv oldu. Necə ki, gələn ayədə xəbər verir).

**49) (وَاِذْ نَجَّيْنَاكُمْ) - yadınıza salın, ey bəni-İsrail, o zaman ki, sizə** (ata-babalarınıza və sizə də onların belində) **nicat verdik, (مِنْ اٰلِ فِرْعَوْنَ) - firona yaxın olan tabelərindən və əmirlərindən, (يَسُومُونَكُمْ) - bir halda ki, sizə edilməsini təklif və tələb edirdilər, (سُوٓءَ الْعَذَابِ) - əzabların ən pisini,** (ən pis əzab bu idi:) **(يُذَبِّحُونَ اَبْنَآءَكُمْ) - qətl edib oğlanlarınızın başını kəsirdilər, (وَيَسْتَحْيُونَ) - və sağ qoyurdular, (نِسَآءَكُمْ) - qadınlarınızı* (وَفِي ذٰلِكُمْ) - siz bəni-İsrailin bu bəlaya düşüb əzab edilməniz, (بَلَآءٌ مِنْ رَبِّكُمْ عَظِيمٌ) - sizdən ötrü böyük bir bəla idi, rəbbiniz Allah-Təala öz əməllərinizə görə o bəlanı sizə düçar elədi.**

*(*Qeyd: Çünki qibtilər bəni-İsrailin qadınlarını öldürməyib özlərinə kəniz edirdilər).*

**50) (وَاِذْ) - yadınıza salın,** (ey bəni-İsrail), **o zaman ki, (فَرَقْنَا بِكُمُ الْبَحْرَ) - sizə görə dənizi bir-birindən ayırdıq ki, dənizə daxil olasınız, (فَاَنْجَيْنَاكُمْ) – sizə nicat verdik, sizdən sonra dənizə firon özü və qoşunu daxil oldu,**

وَاَغْرَقْنَٓا اٰلَ فِرْعَوْنَ وَاَنْتُمْ تَنْظُرُونَ ﴿٥٠﴾

---

**(وَاَغْرَقْنَٓا اٰلَ فِرْعَوْنَ) - siz nicat tapandan sonra** (suda) **qərq elədik Fironun özünü və ona yaxın olan şəxsləri və qoşununu və hamısını həlak elədik. (وَاَنْتُمْ تَنْظُرُونَ) – elə bir halətdə ki, siz baxıb gördünüz, firon və onun qoşunu necə qərq olub həlak oldular.**** (Siz bəni-İsrailin ata-babalarını belə bir bəladan xilas etmək sizə nicat vermək deməkdir. Əgər onlara nicat verməsəydim, siz bu günkü gündə yer üzündə əmr və qadağalar sahibi olmazdınız. Belə bir nemətə şükür etməzsinizmi?)

*(*****Qeyd:*** *Allah-Təala fironu Qırmızı dənizdə qərq elədi, Hz. Musa ilə Fironun əhvalatının təfsilatı bundan sonra gələn surələrdə qeyd olunacaqdır. Burada Firon və Hz. Musa əhvalatı və Fironun dənizdə qərq olunması müxtəsər qeyd olunub. O zaman ki, Hz. Yusif ibn İsrail (Yaqub) Misirdə firona vəzir oldu və onun qardaşları Misirə gəldilər, qardaşlarına əmr edib, atası Yaqubu bütün ailəsi ilə birlikdə Misirə gətizdirdi. Hz. Yaqub Misirə varid olan zamanda 12 oğlu və onların övladları bütünlükdə 76 nəfər idilər. Hz. Yaqub Misirdə vəfat elədi. Hz. Yusifin əmri ilə onun mübarək bədənini mumiyaladılar ki, dağılmaqdan qorunsun. Aparıb Kənan diyarında əcdadı Hz. İbrahimin türbəsinin yanında dəfn etdilər. Bəni-İsrail Misiri özlərinə vətən seçdi və nə zaman ki Hz. Yusif vəfat elədi, onun da mübarək bədənini mumiyaladılar və Misir əhli o cənabın bədəninin Kənana aparılmasına mane oldu. Birləşib Misirə axan Nil çayının ortasında Hz. Yusifdən ötrü məzar hazırladılar. O cənabın bədənini mərmər sandığın içinə qoyub, o çayın ortasında dəfn elədilər ki, su onun üstündən axıb, Misirə daxil olub, əhali də ondan bərəkət tapsın. Hz. Musanın parlaq ulduzu bəni-İsrailin üfüqündən doğmağa yaxın, Firon gecə vaxtı röyada gördü ki, bir od zahir olub bütün Misir əhlini əhatə elədi və bütün qibtiləri yandırıb həlak elədi, bəni-İsrail camaatına isə heç bir zərər dəymədi. Firon yuxudan oyanıb, kahinləri və yuxu yozanları çağırıb, yuxunun yozumunu soruşdu. Cavab verdilər ki, bundan sonra bəni-İsrail tayfasından bir şəxs ortaya çıxacaqdır ki, sənin səltənətin onun əlində məhv olacaqdır. Buna görə də, Firon əmr elədi ki, bundan sonra bəni-İsrail camaatından nə ki oğlan uşağı dünyaya gəlsə, qətl etsinlər. Bir neçə il onları qətl etdilər. Axırda qibtilər özləri Firona şikayət elədilər ki, bəni-İsrailin oğlan uşaqlarını qətl edirsən, bəs bundan sonra bizə kim muzdur olacaqdır? Qibtilərin xahişinə görə firon əmr elədi ki, bir il onların oğlan uşaqlarını qətl etsinlər, bir il azad buraxsınlar. Əfv ilində Harun, qətl ilində isə Musa anadan oldu. O zaman ki, Hz. Musa Allah-Təala tərəfindən Fironu dəvət etməklə əmr olundu, firon o əsnada iman gətirməyib, bəni-İsrail tayfasına böyük zülmlər edirdi. Hz. Musaya Allah-Təala tərəfindən əmr edildi ki, bəni-İsraili gecə vaxtı götürüb Misirdən çıxsın. Hz. Musa Allah-Təalanın əmri ilə bəni-İsraili toplayıb, gecə vaxtı Misirdən köçdü. Firon xəbərdar olub, qoşunu götürüb onların dalınca getdi. Hz. Musa Qırmızı dənizin sahilinə çatanda arxasından Firon və onun qoşunu göründü. Bəni-İsrail çox qorxdu. Allah-Təala Musaya əmr elədi ki, əlində olan əsanı dənizə vur. Hz. Musa əsanı dənizə vurdu, dəniz yarıldı, Hz. Musa və bəni-İsrail dənizə daxil oldular. Firon arxadan yetişib bu əhvalatı görəndə çaşıb qaldı. Çünki xalq ona səcdə*

وَاِذْ وٰعَدْنَا مُوسٰٓى اَرْبَع۪ينَ لَيْلَةً ثُمَّ اتَّخَذْتُمُ الْعِجْلَ مِنْ بَعْدِه۪ وَاَنْتُمْ ظَالِمُونَ ﴿٥١﴾ ثُمَّ عَفَوْنَا عَنْكُمْ
مِنْ بَعْدِ ذٰلِكَ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٥٢﴾ وَاِذْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ وَالْفُرْقَانَ لَعَلَّكُمْ تَهْتَدُونَ ﴿٥٣﴾
وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِه۪ يَا قَوْمِ اِنَّكُمْ ظَلَمْتُمْ اَنْفُسَكُمْ بِاتِّخَاذِكُمُ الْعِجْلَ فَتُوبُٓوا اِلٰى بَارِئِكُمْ فَاقْتُلُٓوا
اَنْفُسَكُمْ ط ذٰلِكُمْ

---

*edib rəbb deyirdi. Özü ilə qürrələnib dedi: bu dəniz mənim qorxumdan yarılıbdır. Bu kəlamı deyib dənizə daxil oldu. Allah-Təala Musa və onun qövmü bəni-İsrailə nicat verib, Firon və ona tabe olanları dənizdə qərq elədi).*

**51) (وَاِذْ) - yadınıza salın, ey bəni-İsrail, o zaman ki, (وٰعَدْنَا مُوسٰٓى اَرْبَع۪ينَ لَيْلَةً) - vəd elədik Musaya ki, Turi-Sinaya gəlib orada 40 gecə qalsın, ta ki ona Tövratı nazil edək, (ثُمَّ اتَّخَذْتُمُ الْعِجْلَ مِنْ بَعْدِه۪) - Musa Turi-Sinaya gedəndən sonra bir buzovu özünüz üçün məbud seçib, ona ibadət elədiniz. (وَاَنْتُمْ ظَالِمُونَ) - halbuki buzovu özünüzə məbud seçməklə özünüzə zalım oldunuz.**

**52) (ثُمَّ عَفَوْنَا عَنْكُمْ مِنْ بَعْدِ ذٰلِكَ) - buzova ibadət edib tövbə eləyəndən sonra sizin günahlarınızı əfv edib bağışladıq. (لَعَلَّكُمْ تَشْكُرُونَ) - Allah-Təala tövbənizi qəbul eləyib günahlarınızı bağışladığına görə, əlbəttə, gərək siz Allah-Təalaya şükür edəsiniz.** (Amma yəhudi tayfası həmişə nankorluq edib, heç vaxt Allah-Təalaya şükür etmədi. Necə ki onların tarixi buna şəhadət edir).

**53) (وَاِذْ) - yadınıza salın,** (ey bəni-İsrail), **o zaman ki, (اٰتَيْنَا مُوسَى الْكِتَابَ وَالْفُرْقَانَ) - Musaya haqq ilə batil arasında fərq qoyan kitab** (Tövrat) **verdik. (لَعَلَّكُمْ تَهْتَدُونَ) - siz gərək o Tövratın səbəbinə haqq yola hidayət tapıb, düz olan yolda sabit olasınız.** (Bəni-İsrail buzova sitayiş etməyin qəbahətini bilib tövbə edəndə Allah-Təala tərəfindən Hz. Musaya əmr olundu ki, onların tövbəsi o vaxt qəbul olunacaq ki, buzova ibadət edənlər sakit durub, ibadət etməyənlər onları qətl etsinlər, o vaxt öldürülən şəxslərin tövbəsi qəbul olunar. Onlar da razı oldular. Onlardan bir qrupu qətl etdilər. Qalanlarının tövbəsi qəbul olunub, qətldən xilas oldular. Necə ki gələn ayədə xəbər verir).

**54) (وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِه۪) - yadınıza salın,** (ey bəni-İsrail), **o zaman ki Musa öz qövmünə** (buzova ibadət edənlərə) **dedi: (يَا قَوْمِ) - ey mənim qövmüm, (اِنَّكُمْ) - həqiqətən, siz, (ظَلَمْتُمْ اَنْفُسَكُمْ بِاتِّخَاذِكُمُ الْعِجْلَ) - buzovu özünüzə məbud etməklə özünüzə zülm elədiniz. (فَتُوبُٓوا) - tövbə edin buzova sitayiş etdiyinizə görə, qayıdın, (اِلٰى بَارِئِكُمْ) öz xaliqiniz Allah-Təalanın tərəfinə. (فَاقْتُلُٓوا) - qətl edin, ey buzova sitayiş eləyən şəxslər, (اَنْفُسَكُمْ) – özünüzdən** (bəni-İsraildən) **olan o şəxsləri ki, buzova sitayiş eləyiblər.** (Çünki bəni-İsrail hamısı Yaqub peyğəmbərin nəslindən olub, bir-biriləri ilə qohum idilər. Bəziləri buzova sitayiş edib, bəziləri sitayiş etməmişdi. Oğul ibadət edib, ata etməmişdi. Ya da ata ibadət edib, oğul etməmişdi. Allah-Təala bir nəsildən olduqlarına görə, bəni-İsraili bir-birinin eyni sayıb, onlara elə xitab elədi.) **(ذٰلِكُمْ) - sizin**

خَيْرٌ لَكُمْ عِنْدَ بَارِئِكُمْ فَتَابَ عَلَيْكُمْ اِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ ﴿٥٤﴾ وَاِذْ قُلْتُمْ يَا مُوسٰى لَنْ نُؤْمِنَ
لَكَ حَتّٰى نَرَى اللّٰهَ جَهْرَةً فَاَخَذَتْكُمُ الصَّاعِقَةُ وَاَنْتُمْ تَنْظُرُونَ ﴿٥٥﴾

---

**öldürülməyiniz, (خَيْرٌ لَكُمْ عِنْدَ بَارِئِكُمْ) - xaliqiniz Allah-Təala yanında sizdən ötrü xeyirli bir əməldir. (فَتَابَ عَلَيْكُمْ) – elə ki siz tövbə eləyib, qətl edilməyə səbir etdiniz, Allah-Təala da sizin tövbənizi qəbul etdi, (اِنَّهُ هُوَ التَّوَّابُ الرَّحِيمُ) - həqiqətən, Allah-Təala məxluquna rəhm edib onların tövbəsini qəbul eləyəndir.** (O vaxt ki Hz. Musa Tövratdan ötrü Tura gedib 40 gecə orada qaldı, bəni-İsrail arasında Samiri adında fəsadçı bir kişi var idi. Zərgər verməkdə xeyli usta olub, hoqqabazlıq elmindən də bir az bilirdi. Qızıldan buzov heykəli düzəldib, onu elə tərtib etmişdi ki, nə vaxt hərəkət etdirilsə, ondan buzov səsi kimi bir səs çıxırdı. Bəni-İsrailə dedi: bu, sizin məbudunuzdur. Musa bunu burada unudub Tura getdi. Bəni-İsrail əhli elmsiz və sadə insanlar olduğundan əksəriyyəti ona səcdə elədilər. (Bəli, elmsizlik və cəhalət insanı böyük yanlış əməllərə və xətalara vadar edir. Bəni-İsrail bunu anlamadı ki, belə şeylər insandan elm üzrə meydana gələr). Hz. Musa Turdan qayıdıb, Tövratı gətirib onları o halda görəndə son dərəcə qəzəblənib, onları məzəmmət elədi. Onlar da tövbə etdilər. Tövbələrinə şərt qoşuldu ki, gərək öldürülsünlər. Necə ki keçən ayədə qeyd olundu. Bəni-İsrail buzova ibadət etdiyinə görə, tövbə edəndən sonra Hz. Musa bəni-İsrailin rəislərindən 70 nəfəri seçib, özü ilə Turi-Sinaya apardı ki, ora müqəddəs olduğuna görə, orada tövbə edib peşmanlıqlarını izhar etsinlər.

Hz. Musa Tura çatıb, Turun zirvəsinə çıxıb, dua ilə məşğul olanda bəni-İsraildən 70 nəfərlə Musa arasında nurdan bir pərdə çəkilib, Musanı nur əhatə elədi, onlar da Hz. Musanı görə bilmədilər. O vaxt ki Hz. Musa duasını qurtarıb, bəni-İsrailə göründü, dedilər: ey Musa, biz Allah-Təalanı aşkar görmədikcə sənə iman etmərik. Ancaq bundan sonra sənə iman gətirərik. Elə ki bəni-İsrail bu küfr sözü dedi, səmadan bir od gəlib onları yandırıb həlak elədi. Ondan sonra Hz. Musanın duasıyla Allah-Təala onlara yenidən həyat verdi. Necə ki bundan sonra gələn ayədə bəyan olunur).

**55) (وَاِذْ قُلْتُمْ) - yadınıza salın, ey bəni-İsrail, o zaman ki dediniz,** (yəni babalarınız Turda Musaya dedi:) **(يَا مُوسٰى لَنْ نُؤْمِنَ لَكَ) - ey Musa, heç vaxt sənə iman etmərik, (حَتّٰى نَرَى اللّٰهَ جَهْرَةً) – ta ki gözümüzlə Allah-Təalanı aşkar şəkildə görək, ondan sonra sənə iman gətirərik. (فَاَخَذَتْكُمُ الصَّاعِقَةُ) - dediyiniz bu küfr kəlməsinin səbəbi ilə səmadan şiddətli səslə bir ildırım gəlib, sizi yandırıb həlak elədi. (وَاَنْتُمْ تَنْظُرُونَ) - Bir haldaki siz gördünüz ki, səmadan gələn ildırım sizi necə həlak etdi.**

ثُمَّ بَعَثْنَاكُمْ مِنْ بَعْدِ مَوْتِكُمْ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٥٦﴾ وَظَلَّلْنَا عَلَيْكُمُ الْغَمَامَ وَاَنْزَلْنَا عَلَيْكُمُ الْمَنَّ
وَالسَّلْوٰى كُلُوا مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ وَمَا ظَلَمُونَا وَلٰكِنْ كَانُوٓا اَنْفُسَهُمْ يَظْلِمُونَ﴿٥٧﴾ وَاِذْ قُلْنَا
ادْخُلُوا هٰذِهِ الْقَرْيَةَ فَكُلُوا مِنْهَا حَيْثُ شِئْتُمْ رَغَدًا وَادْخُلُوا الْبَابَ سُجَّدًا وَقُولُوا حِطَّةٌ

---

**56) (ثُمَّ بَعَثْنَاكُمْ مِنْ بَعْدِ مَوْتِكُمْ) - ölümünüzdən sonra Musanın duasıyla yenidən sizə həyat verdik. (لَعَلَّكُمْ تَشْكُرُونَ) - əlbəttə, siz gərək bu böyük nemətə** (öləndən sonra yenidən dirilməyə) **şükür edəsiniz.** (Allah-Təala öz nemətlərini bəni-İsrailə bəyan edir: o vaxt ki dənizdən nicat tapıb biyabanda qaldılar, günün altında nə sığınacaq var idi, nə də yemək. Allah-Təala öz rəhmətini onlara şamil edib, onlar üçün kölgəlik edib, ruzi göndərdi. Necə ki gələn ayədə xəbər verir).

**57) (وَظَلَّلْنَا عَلَيْكُمُ الْغَمَامَ) - ey bəni-İsrail, buludları sizə kölgə etdik. Ta ki günün hərarəti sizə təsir etməsin.** (Allah-Təala öz qüdrəti ilə havanı həmişə buludlu etdi ki, günəşin hərarəti onlara təsir etməsin). **(وَاَنْزَلْنَا عَلَيْكُمُ الْمَنَّ) - yeməkdən ötrü sizə “tərəncibin” - qüdrət halvasını göndərdik.** (Tərəncibin – bitki kimi bir şeydir, gecə vaxtı tikanlı bitkilərin üstündə yaranır). **(وَالسَّلْوٰى) - bir də bildirçin göndərdik.** (Hər səhər bəni-İsrail durub görürdü ki, çadırların kənarında kifayət qədər qüdrət halvası və bildirçin var. Qüdrət halvasını toplayıb, bildirçinləri də tutub kəsirdilər. Bunlara baxmayaraq, Allah-Təalaya nankorluq edib, itaətdən çıxdılar). **(كُلُوا) - ey bəni-İsrail, yeyin. (مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ) - sizə verdiyimiz pak ruzilərdən, (وَمَا ظَلَمُونَا) - bəni-İsrail nankorluq etməklə bizə bir zülm etmədilər. (وَلٰكِنْ كَانُوٓا اَنْفُسَهُمْ يَظْلِمُونَ) - lakin nankorluq etməklə özlərinə zülm elədilər.** (Çünki nankorluğun cəzası insanın özünə aiddir).

**58) (وَاِذْ) - yadınıza salın** (ey bəni-İsrail), **o zaman ki (قُلْنَا ادْخُلُوا) - sizə** (ata-babalarınıza) **dedik: daxil olun, (هٰذِهِ الْقَرْيَةَ) - bu qəsəbəyə,** (Yerusəlimin -Beytülmüqəddəsin yerində olan qəsəbəyə. O dövrdə Yerusəlimin yerində kiçik bir qəsəbə olub, ətrafında hər bir növ meyvə var idi)**. (فَكُلُوا مِنْهَا) - o qəsəbənin hər bir meyvəsindən yeyin. (حَيْثُ شِئْتُمْ رَغَدًا) – istədiyiniz hər yerdə asanlıqla və rahatlıqla o meyvələrdən yeyin. (Bəni-İsrail Misirdən çıxb, dənizdən nicat tapıb biyabanda qalan zamanda Hz. Musa onların ibadət etmələrindən ötrü bir çadır düzəltdirmişdi. O çadıra “xeyməyi-mücəmmə” deyirdilər. O çadırın təfsilatı Tövratda qeyd olunubdur. Allah-Təala o çadırın barəsində bundan sonra gələn hökmü bəni-İsrailə buyurur: (وَادْخُلُوا الْبَابَ سُجَّدًا)** – (ey bəni-İsrail), **o çadırın qapısından daxil olanda səcdə eləyən halda daxil olun.** (Yəni çadıra daxil olanda əvvəlcə Allah-Təalaya səcdə eləyib, ondan sonra daxil olun). **(وَقُولُوا حِطَّةٌ) - səcdə eləyəndən sonra deyin: “Ey Allah, buraya daxil olmaq bizim üçün günah-**

نَغْفِرْ لَكُمْ خَطَايَاكُمْۜ وَسَنَزِيدُ الْمُحْسِنِينَ ﴿٥٨﴾ فَبَدَّلَ الَّذِينَ ظَلَمُوا قَوْلًا غَيْرَ الَّذِي قِيلَ لَهُمْ فَاَنْزَلْنَا
عَلَى الَّذِينَ ظَلَمُوا رِجْزًا مِنَ السَّمَاۤءِ بِمَا كَانُوا يَفْسُقُونَ۟ ﴿٥٩﴾ وَاِذِ اسْتَسْقٰى مُوسٰى لِقَوْمِه۪ فَقُلْنَا
اضْرِبْ بِعَصَاكَ الْحَجَرَۜ فَانْفَجَرَتْ مِنْهُ اثْنَتَا عَشْرَةَ عَيْنًاۜ قَدْ عَلِمَ كُلُّ اُنَاسٍ مَشْرَبَهُمْۜ كُلُوا وَاشْرَبُوا
مِنْ رِزْقِ اللّٰهِ وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدِينَ ﴿٦٠﴾ وَاِذْ قُلْتُمْ يَا مُوسٰى لَنْ نَصْبِرَ عَلٰى طَعَامٍ وَاحِدٍ

---

**ların tökülməsidir. Bizim günahlarımızdan keçib əfv et. (نَغْفِرْ لَكُمْ خَطَايَاكُمْ) - bu sözü deyib əfv edilmək istədiyiniz üçün günahkar olanlarınızın günahını bağışlayarıq. (وَسَنَزِيدُ الْمُحْسِنِينَ) - yaxşı əməl edənlərin əcr və savabını artıq edərik.**

**59) (فَبَدَّلَ الَّذِينَ ظَلَمُوا) - zalım olan bəni-İsrail dəyişdi, (قَوْلًا غَيْرَ الَّذِي قِيلَ لَهُمْ) - onlara deyilən sözü başqa bir sözlə əvəz etdilər.** (Bəni-İsrailə əmr olundu ki, çadıra daxil olanda səcdə eləyib bağışlanmaq diləyin. Bəni-İsrail səcdəni tərk eləyib, əfv edilməyi istəmək əvəzinə, boş və mənasız sözlər dedilər). **(فَاَنْزَلْنَا عَلَى الَّذِينَ ظَلَمُوا) - zalım olan bəni-İsrailə göndərdik, (رِجْزًا مِنَ السَّمَاۤءِ) - səmadan bir əzab, (بِمَا كَانُوا) - o səbəbə görə ki, onlar, (يَفْسُقُونَ) – günaha dalıb, Allah-Təalanın əmr elədiyi sözü dəyişdirib, onun əvəzində boş sözlər dedilər.** (Allah-Təala taun xəstəliyini onlara düçar edib, onlardan 24 min nəfər həlak oldu. İlahi, bizim əməllərimizə görə bizimlə belə rəftar etmə, öz lütf və ucalığınla bizim xətalarımızı əfv et, amin! Bəni-İsrail dənizdən nicat tapandan sonra Allah-Təaladan su xahiş elədi. Necə ki gələn ayədə xəbər verir).

**60) (وَاِذِ اسْتَسْقٰى مُوسٰى) - yadınıza salın ey bəni-İsrail, o zaman ki Musa Allah-Təaladan su istədi, (لِقَوْمِه۪) - öz qövmü üçün,** (siz yəhudilərin ata-babalarınızdan ötrü), **(فَقُلْنَا اضْرِبْ بِعَصَاكَ الْحَجَرَ) - Musaya dedik: əlindəki o əsanı daşa vur. Hz. Musa əsanı daşa vurub, (فَانْفَجَرَتْ مِنْهُ) - o daşdan açıldı, (اثْنَتَا عَشْرَةَ عَيْنًا) - on iki çeşmə,** (Bəni-İsrail Yaqubun 12 oğlundan 12 tayfa idi. Hər bir tayfadan ötrü bir çeşmə zahir oldu). **(قَدْ عَلِمَ كُلُّ اُنَاسٍ) - həqiqətən, agah oldu bəni-İsrailin hamısı, (مَشْرَبَهُمْ) - öz su içən hallarına.** (Hz. Musa hər bir tayfa üçün bir çeşmə təyin elədi. Ta ki bir-birilərinə qarışıb, fəsada səbəb olmasınlar). **(كُلُوا وَاشْرَبُوا) - o vaxtda Hz. Musanın vasitəsilə bəni-İsrailə dedik: yeyin, için, ey bəni-İsrail, (مِنْ رِزْقِ اللّٰهِ) - Allah-Təalanın sizə verdiyi ruzilərdən.** (Yemək üçün qüdrət halvası, bildirçin, içmək üçün daşdan çıxan su, hansı ki ən şirin su məhz daşdan çıxan sudur. Buna baxmayaraq, yenə də bəni-İsrail Allah-Təalaya asi olub nankorluq elədi). **(وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدِينَ) - yer üzündə fəsad törətdiyiniz halda asi olub Allah-Təalanın itaətindən çıxmayın.** (Gərək bu nemətlərin müqabilində fəsadı tərk eləyəsiniz. Amma heç bir vaxt fəsadı tərk etməyib, xeyir tərəfinə meyil etmirsiniz).

**61) (وَاِذْ قُلْتُمْ يَا مُوسٰى) - yadınıza salın** (ey bəni-İsrail), **o zaman ki Musaya**

فَادْعُ لَنَا رَبَّكَ يُخْرِجْ لَنَا مِمَّا تُنْبِتُ الْاَرْضُ مِنْ بَقْلِهَا وَقِثَّٓائِهَا وَفُومِهَا وَعَدَسِهَا وَبَصَلِهَاۜ قَالَ
اَتَسْتَبْدِلُونَ الَّذ۪ي هُوَ اَدْنٰى بِالَّذ۪ي هُوَ خَيْرٌۜ اِهْبِطُوا مِصْرًا فَاِنَّ لَكُمْ مَا سَاَلْتُمْۜ وَضُرِبَتْ عَلَيْهِمُ
الذِّلَّةُ وَالْمَسْكَنَةُ وَبَٓاؤُ۫ بِغَضَبٍ مِنَ اللّٰهِۜ ذٰلِكَ بِاَنَّهُمْ كَانُوا يَكْفُرُونَ بِاٰيَاتِ اللّٰهِ وَيَقْتُلُونَ النَّبِيّ۪نَ بِغَيْرِ
الْحَقِّۜ ذٰلِكَ بِمَا عَصَوْا وَكَانُوا يَعْتَدُونَ ﴿٦١﴾

---

**dediniz: “Ey Musa, (لَنْ نَصْبِرَ عَلٰى طَعَامٍ وَاحِدٍ)** – (Allah-Təalanın bizə bəxş etdiyi) **o tək növ yeməyə heç vaxt səbir etmərik,** (qüdrət halvası ilə, bildirçinlə kifayət etmərik). **(فَادْعُ لَنَا رَبَّكَ) - çağır bizdən ötrü öz rəbbin Allah-Təalanı. (يُخْرِجْ لَنَا مِمَّا تُنْبِتُ الْاَرْضُ) - yerdə bitən şeylərdən bizim üçün çıxarsın. (مِنْ بَقْلِهَا) - yerin tərəvəzindən** (nanə, kəvər, keşniş və başqalarından), **(وَقِثَّٓائِهَا) - yerin xiyarından, (وَفُومِهَا) - sarımsaqdan, (وَعَدَسِهَا) - mərcisindən, (وَبَصَلِهَا) - soğanından, (قَالَ) - Musa onlara cavabında dedi: (اَتَسْتَبْدِلُونَ الَّذ۪ي هُوَ اَدْنٰى) – bəs dəyişdirmək istəyirsiniz o şeyi ki dəyərsiz və əskikdir, (بِالَّذ۪ي هُوَ خَيْرٌ) - o şeylə ki, o,** (qüdrət halvası və bildirçin) **siz istəyən şeylərdən yaxşıdır,** (indi ki siz bəni-İsrail, belə şeylər xahiş edirsiniz), **(اِهْبِطُوا مِصْرًا) - bu çöldən çıxıb bir şəhərə daxil olun, bu şeylər ki, siz xahiş edirsiniz, biyabanda tapılmaz. Bunlar şəhərdə olan şeylərdir,** (və halbuki siz Allah-Təalaya asi olduğunuz üçün şəhərə daxil olmağınız qadağandır. Bəni-İsrail həmin biyabanda 40 il sərgərdan qaldı. Hz. Musa və Harun həmin biyabanda vəfat etdilər. 40 ildən sonra Yuşa ibn Nun vasitəsilə bəni-İsrail Şama daxil oldu). **(فَاِنَّ لَكُمْ مَا سَاَلْتُمْ) - xahiş etdiyiniz hər bir şey şəhərdə sizdən ötrü hazırdır. Gərək şəhərə daxil olub o şeyləri tapasınız. (وَضُرِبَتْ عَلَيْهِمُ الذِّلَّةُ وَالْمَسْكَنَةُ) - bəni-İsrail asi olduğuna görə, zillət və həqirlik onları bürüdü. (وَبَٓاؤُ بِغَضَبٍ مِنَ اللّٰهِ) - Allah-Təala tərəfindən qəzəbə layiq oldular. (ذٰلِكَ) - bu ilahi qəzəbə düçar olmaq, (بِاَنَّهُمْ كَانُوا يَكْفُرُونَ بِاٰيَاتِ اللّٰهِ) - o səbəbə görədir ki, Allah-Təala tərəfindən gələn möcüzələri inkar edib, (وَيَقْتُلُونَ النَّبِيّ۪نَ) - peyğəmbərləri qətlə yetirdilər. (Şüeyb, Zəkəriyya, Yəhya və bunlardan başqa peyğəmbərləri də qətlə yetirdilər). (بِغَيْرِ الْحَقِّ) - halbuki özləri bilirdilər ki, peyğəmbəri qətlə yetirmək haqsız əməldir. (ذٰلِكَ) - yenə onların bu zəlil olması, (بِمَا عَصَوْا) - o səbəbə görədir ki, Allah-Təalaya asi olub, Onun itaətindən çıxdılar. (وَكَانُوا يَعْتَدُونَ) - bəni-İsrail Allah-Təalanın qoyduğu ehkamı pozub, həddi aşmışdı.** (Bu ayədə qeyd olunan yəhudilərin zəlil və həqir olması xəbəri bizim yolumuzun doğru və haqq olmasına böyük dəlildir. Uca peyğəmbərimizin hicrətindən 1319 il keçib, bu xəbərin doğruluğu sabit olub, yəhudilər həmişə zillət içində olub günbəgün daha zəlil olurlar. Hər bir peyğəmbərin haqq olmasının ən böyük dəlillərdən biri əvvəlcədən o işi xəbər verməkdir ki, o iş gələcəkdə vaqe olacaq. (Gələn ayədə Allah-Təala bəyan edir ki, iman gərək həqiqi və səmimi olsun ki, insana fayda versin. Zahiri iman kifayət etməz).

اِنَّ الَّذ۪ينَ اٰمَنُوا وَالَّذ۪ينَ هَادُوا وَالنَّصَارٰى وَالصَّابِئ۪ينَ مَنْ اٰمَنَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ وَعَمِلَ صَالِحًا فَلَهُمْ
اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْۚ وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٦٢﴾ وَاِذْ اَخَذْنَا م۪يثَاقَكُمْ وَرَفَعْنَا فَوْقَكُمُ
الطُّورَۜ خُذُوا مَٓا اٰتَيْنَاكُمْ بِقُوَّةٍ وَاذْكُرُوا مَا ف۪يهِ لَعَلَّكُمْ تَتَّقُونَ ﴿٦٣﴾ ثُمَّ تَوَلَّيْتُمْ مِنْ بَعْدِ ذٰلِكَۚ

---

**62) (اِنَّ الَّذ۪ينَ اٰمَنُوا) - həqiqətən, o şəxslər ki zahirdə Qurana iman gətiriblər, (وَالَّذ۪ينَ هَادُوا وَالنَّصَارٰى) - və o şəxslər ki yəhudi və xristian olublar,** (Musa ümmətinə yəhudi, İsa ümmətinə xristian deyilir). **(وَالصَّابِئ۪ينَ) - o şəxslər ki mələklərə və ulduzlara sitayiş edirlər, (مَنْ اٰمَنَ بِاللّٰهِ) - bu qeyd olunan şəxslərdən kim ki doğrudan və səmimi qəlblə Allah-Təalaya və onun peyğəmbərlərinə, o cümlədən Hz. Məhəmmədə iman gətirsə,** (hərçənd peyğəmbərimiz olan Hz. Məhəmmədə iman gətirmək ayədə qeyd olunmayıbdır. Amma Allah-Təalaya iman gətirməyin içində o da var. Qurani-Şərifdə vaqe olan digər ayələr bu mətləbə dəlildir), **(وَالْيَوْمِ الْاٰخِرِ) - və qiyamət gününə** (iman edib), **(وَعَمِلَ صَالِحًا) - və yaxşı əməl eləsə, (فَلَهُمْ اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْ) – onlardan ötrü rəbləri Allah-Təalanın əcr, savab vardır. (وَلَا خَوْفٌ عَلَيْهِمْ) - qiyamət gününün əzabından onlara qorxu yoxdur, (وَلَا هُمْ يَحْزَنُونَ) - qəmgin və hüznlü də olmazlar.**

**63) (وَاِذْ اَخَذْنَا م۪يثَاقَكُمْ) - yadınıza salın,** (ey bəni-İsrail)**, o zaman ki sizdən Musa vasitəsilə möhkəm olan əhdinizi aldıq ki, gərək Tövrata əməl edəsiniz.** (Tövrat nazil olmadan qabaq Hz. Musa bəni-İsraildən möhkəm əhd aldı ki, gərək Tövrata əməl edəsiniz. Onlar da qəbul etdilər), **bununla belə Tövrata əməl etmədiniz. (وَرَفَعْنَا) - ucaltdıq, (فَوْقَكُمُ الطُّورَ) – Turi-Sinanı başınızın üstündə*, ta ki qorxub Tövrata əməl edəsiniz. (خُذُوا) - və sizə dedik: qəbul edib alın, (مَٓا اٰتَيْنَاكُمْ) - o ehkamı ki, bu Tövratda sizə nazil eləmişik, (بِقُوَّةٍ) - doğruluq ilə əzmli olun, əlbəttə, gərək ona əməl edəsiniz. (وَاذْكُرُوا مَا ف۪يهِ) – bir-birinizlə danışıb, Tövratın ehkamını oxuyub, yadda saxlayın , (لَعَلَّكُمْ) - əlbəttə, siz Tövratın ehkamına əməl etməklə, (تَتَّقُونَ) - gərək Allah-Təaladan qorxub, pis əməlləri tərk edəsiniz.**

*(***Qeyd:** *Bəni-İsrail Tövratın ehkamını qəbul etmədi. Allah-Təala onları qorxutmaqdan ötrü Turi-Sinanın surətini onların başının üstündə göstərdi. Amma əgər onların başının üstünə düşsəydi, həqiqətən bir dağın düşməsi ilə hamısı həlak olardı, amma O, həqiqətən, Turi-Sinanı onların başının üstündə göstərdi. Çünki Allah-Təalaya əzab etmək üçün bir vasitə lazım deyil. Allah-Təala mövcud olmayan vasitələri də əzabdan ötrü yarada bilər, lazım deyil ki, dağ, həqiqətən, yerindən qaldırılsın, ondan sonra əzab vaqe olsun. Dağın surəti onlara göstərildi. Əgər ehkamı qəbul etməsəydilər, dağdan gələn əzaba düçar olardılar).*

**64) (ثُمَّ تَوَلَّيْتُمْ مِنْ بَعْدِ ذٰلِكَ) - Sizinlə Tövrata əməl etmək əhdini möhkəm elədikdən sonra o əhddən üz döndərib, Tövrata əməl etmədiniz.**

فَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ لَكُنْتُمْ مِنَ الْخَاسِرِينَ ﴿٦٤﴾ وَلَقَدْ عَلِمْتُمُ الَّذِينَ اعْتَدَوْا مِنْكُمْ فِي السَّبْتِ فَقُلْنَا لَهُمْ كُونُوا قِرَدَةً خَاسِئِينَ ﴿٦٥﴾ فَجَعَلْنَاهَا نَكَالًا لِمَا بَيْنَ يَدَيْهَا وَمَا خَلْفَهَا وَمَوْعِظَةً لِلْمُتَّقِينَ ﴿٦٦﴾

---

(فَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ) **- Allah-Təalanın fəzilət və rəhməti siz bəni-İsrailə şamil olmasaydı,** (hansı ki bu əhdi pozandan sonra Allah-Təala sizə lütf edib tövbə etdiniz), (لَكُنْتُمْ مِنَ الْخَاسِرِينَ) **- əlbəttə, dünya və axirətdə ziyankar və çaşqın şəxslərdən olardınız.** (Allah-Təala bu gələn ayədə o bəni-İsraili qorxudur ki, peyğəmbərin zamanında yaşayırdılar. Yəni ey bəni-İsrail, necə ki sizdən əvvəl şənbə gününün hörmətini saxlamayan ata-babalarınıza əzab nazil elədim, habelə sizə də Hz. Məhəmmədi və Quranı təkzib etdiyiniz üçün əzab edərəm).

**65)** (وَلَقَدْ عَلِمْتُمُ) **- həqiqətən, siz bəni-İsrail bilibsiniz,** (الَّذِينَ اعْتَدَوْا مِنْكُمْ) **- sizdən əvvəl babalarınızın həddi aşıb Allah-Təalaya asi olduğunu,** (فِي السَّبْتِ) **- şənbə günü haqqında Allah-Təalaya asi olub, şənbə gününün ehtiramını qorumadılar.** (فَقُلْنَا لَهُمْ) **- onlara dedik:** (Allah-Təalanın deməsi onun istəməsidir), (كُونُوا قِرَدَةً) **- meymun olun,** (خَاسِئِينَ) **- Allah-Təalanın rəhmətindən qovulub, uzaq olduğunuz halda.** (Bu qissə Şam mülkündə dəniz kənarında yerləşən bir qəsəbədə Hz. Davud zamanında vaqe olubdur. Qissə belədir:Allah-Təala şənbə gününü bəni-İsraildən ötrü bayram edib, o gün bütün dünya işlərini onlara haram buyurmuşdu. Gərək o gün ancaq Allaha itaət və ibadətlə məşğul olaydılar. Həmin qəsəbədə olan yəhudilərin işi-peşəsi dəniz kənarında yaşadıqları üçün balıq tutmaq idi. Şənbə günündə balıq tutmaq onlara qadağan idi. Amma o gün balıq digər günlərdən çox olurdu. Bundan ötrü fikirləşib, hiylə qurub, dəniz kənarında quyu kimi yerlər düzəldib, dənizdən ora yol açdılar. Şənbə günü olanda balıq çox olub həmin yollardan o quyu kimi yerlərə daxil olub, oradan çıxmaları mümkün olmazdı. Bazar günündə o balıqları ovlayardılar. Bir müddət bu şəkildə hərəkət elədilər. Axırda şənbə gününün hörmətini pozub, itaət və ibadət əvəzində şənbə günündə balıq tutmaqla məşğul oldular və bu səbəbdən Allah-Təala onlara əzab göndərib, onların batinlərini meymun surətinə çevirdi. Meymun kimi məkr və hiylədən başqa heç bir xeyir əməl onlardan meydana gəlməyib, hidayətə qabil olmayıb 3 gündən sonra hamısı həlak oldu).

**66)** (فَجَعَلْنَاهَا) **- biz o yəhudilərin meymun surətinə çevrilmələrini,** (نَكَالًا لِمَا بَيْنَ يَدَيْهَا وَمَا خَلْفَهَا) **- onların zamanında və onlardan sonra dünyaya gələn insanlardan ötrü ibrət etdik.** (وَمَوْعِظَةً لِلْمُتَّقِينَ) **- yenə onların bu hallarını müttəqi şəxslərdən ötrü öyüd-nəsihət etdik. Ta ki görsünlər ki, Allah-Təala öz qüdrətiylə insanı öz pis əməli səbəbi ilə necə öz surətindən çıxarıb meymun surətinə daxil edir və heç bir şəkildə hidayətə qabil olmur-**

وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِه۪ٓ اِنَّ اللّٰهَ يَاْمُرُكُمْ اَنْ تَذْبَحُوا بَقَرَةًۜ قَالُوٓا اَتَتَّخِذُنَا هُزُوًاۜ قَالَ اَعُوذُ بِاللّٰهِ اَنْ اَكُونَ مِنَ الْجَاهِل۪ينَ ﴿٦٧﴾

---

**lar.** (Həqiqi insanlıq halından çıxıb, meymun kimi məkr və hiyləbazlıq etmək meymun surətinə daxil olmaq sayılır). Bundan sonra gələn bir neçə ayə o qissəyə işarədir ki, Hz. Musa (s.ə.s) zamanında meydana gəlibdir və o qissə müxtəsər şəkildə belədir: bəni-İsrail arasında bir nəfər varlı şəxs olub, onun bir oğlu və çoxlu qardaşı oğlu var idi. Qardaşı oğlanları onun dövlət və malına sahib olmaq xəyalı ilə onun oğlunu qətlə yetirdilər. Ondan sonra həmin qatillər bəni-İsraili günahlandırıb, öldürülənin qan bahasını tələb elədilər. Bu xəbər Hz. Musaya (s.ə.s) çatdı, o cənab bundan agah oldu. Bəni-İsraildən bir başqa şəxs də dünya malından bir buzova malik olub, sadəcə kiçik bir oğlu var idi. Elə ki o şəxsin əcəli yaxınlaşıb, öləcəyini hiss elədi, həmin buzovu meşəyə aparıb, dedi: ilahi, bu buzovu sənə o kiçik oğlumdan ötrü əmanət tapşırıram. Buzovu meşəyə buraxdı. Bir müddət sonra o şəxs vəfat etdi. O buzov həmin meşədə böyüyüb, gözəl bir inək oldu. O kiçik uşaq da həddi-büluğa çatıb, yoxsulluq içində gün keçirirdi. Çöldən odun gətirib satar, onu 3 hissə eləyib bir hissə anasına, bir hissə sədəqəyə və bir hissə özünə sərf edərdi. Bir gün anası ona dedi: oğul, atan səndən ötrü meşədə Allah-Təalaya əmanət tapşırıbdır. Get, onu axtar tap. Həmin cavan meşəyə gəlib, atasının əmanət qoyduğu buzovun gözəl bir inək olduğunu gördü. O vaxta kimi heç bir şəxsə tabe olmamışdı. Elə ki o cavan ona yaxınlaşdı, inək o şəxsə tabe oldu, o da onu tutub evinə gətirdi. O vaxt da həmin öldürülmüş şəxsin əhvalatı vaqe oldu. Allah-Təalanın əmri belə oldu ki, o şəxsi dirildin. Ta ki öz qatillərini xəbər verib, o zaman qiyaməti inkar edənlərdən ötrü bir əlamət olsun və o inək sahibinə də mənfəət versin və bu səbəbdən Allah-Təala Hz. Musaya (s.ə.s) əmr elədi ki, gərək öldürülənin əmisi oğlanları bir inək kəssinlər. Ta ki dirilib öz qatilini xəbər versin. O vəsfdə inək ki, onu kəsməklə əmr olunmuşdular, onu axtarandan sonra həmin cavanın yanında tapdılar. Baha qiymətə onu alıb, kəsəndən sonra onun bir parçasını ölüyə vurdular. Allahın izni ilə dirilib – mənim qatillərim əmim oğlanlarıdır-deyib yenidən öldü. Hz. Musa onlara cəzalarını verdi. Necə ki bundan sonra gələn ayələrdə qeyd olunacaq).

**67) (وَاِذْ قَالَ مُوسٰى لِقَوْمِه۪ٓ) - yadınıza salın,** (ey bəni-İsrail), **o zaman ki Musa öz qövmündən o cənabı qətlə yetirən şəxslərə dedi: (اِنَّ اللّٰهَ) - həqiqətən, Allah-Təala, (يَاْمُرُكُمْ) – sizə əmr edir, (اَنْ تَذْبَحُوا بَقَرَةً) - bir inək kəsəsiniz, ta ki o heyvanın kəsilməsi ilə bu ölünün sirri aşkar olsun. (قَالُوٓا) - Musanın cavabında dedilər: (اَتَتَّخِذُنَا هُزُوًا) –** (ey Musa), **sən bizə istehza edirsən? Biz səndən bu ölünün qatilini istəyirik. Sən bizə istehza edib inək kəsməyimizi əmr edirsən. (قَالَ اَعُوذُ بِاللّٰهِ) - Musa dedi: Allah-Təalaya pənah aparıram ki, (اَنْ اَكُونَ) olum, (مِنَ الْجَاهِل۪ينَ) - cahil olan şəxslərdən** (olum)**, istehza və məsxərə**

قَالُوا ادْعُ لَنَا رَبَّكَ يُبَيِّنْ لَنَا مَا هِيَ ۚ قَالَ اِنَّهُ يَقُولُ اِنَّهَا بَقَرَةٌ لَا فَارِضٌ وَلَا بِكْرٌ ۖ عَوَانٌ بَيْنَ ذٰلِكَ ۖ
فَافْعَلُوا مَا تُؤْمَرُونَ ﴿٦٨﴾ قَالُوا ادْعُ لَنَا رَبَّكَ يُبَيِّنْ لَنَا مَا لَوْنُهَا ۚ قَالَ اِنَّهُ يَقُولُ اِنَّهَا بَقَرَةٌ صَفْرَاءُ ۙ فَاقِعٌ
لَوْنُهَا تَسُرُّ النَّاظِرِينَ ﴿٦٩﴾ قَالُوا ادْعُ لَنَا رَبَّكَ يُبَيِّنْ لَنَا مَا هِيَ ۙ اِنَّ الْبَقَرَ تَشَابَهَ عَلَيْنَا

---

**etmək cahillərin əməlidir. Mən sizə istehza etməyib, həqiqətən, Allah-Təala tərəfindən sizin inək kəsmənizi əmr edirəm.** (İnək kəsmələri əmr edilən şəxslər elə ki gördülər, Hz. Musa (ə.s), həqiqətən, bu işi onlara ciddi və qəti şəkildə əmr edir, istehza və məsxərə etmir, başladılar kəsmək istədikləri inəyin xüsusiyyətləri haqqında suallar verməyə. Buna görə də, Allah-Təala da onları sıxışdırıb, elə bir vəsfdə inək bəyan etdi ki, ancaq o cavanın inəyində o vəsflər var idi. Halbuki sual verməyib, hər hansı bir inəyi kəssəydilər, kifayət edərdi. Lakin onlar sual verməkdə israr etdilər. Allah-Təala da inəyin vəsflərini nadir və çox edib, onların işini çətinləşdirdi, o vəsfdə inək o cavandan başqa heç bir nəfərin yanında tapılmadı, baha qiymətə o inəyi alıb, onu kəsdilər).

**68) (قَالُوا) – inəyi kəsməklə əmr olunanlar dedilər: (ادْعُ لَنَا رَبَّكَ)** – (ey Musa), **öz rəbbini bizdən ötrü çağır, (يُبَيِّنْ لَنَا) – ta ki bizdən ötrü bəyan və aşkar eləsin, (مَا هِيَ) - o qəribə inək nə xüsusiyyətdə, nə halda və nə yaşdadır?** (O kəsilmiş inəyin bir parçasını ölüyə vurmaqla onun dirilməsinə təəccüb eləyib, o inəyin vəsflərini soruşmaqda israr etdilər. Yəni bu necə inəkdir ki, onun bir parçasını ölüyə vurmaqla o ölü dirilsin? Ey Musa, onun vəsfini bizdən ötrü dürüst bəyan elə). **(قَالَ) - Hz. Musa dedi: (اِنَّهُ يَقُولُ) - Allah-Təala buyurur: (اِنَّهَا بَقَرَةٌ) – o, bir inəkdir ki, onun vəsfi belədir: (لَا فَارِضٌ) - nə çox yaşlı və nə çox qocadır, (وَلَا بِكْرٌ) - və nə də çox cavandır. (عَوَانٌ بَيْنَ ذٰلِكَ) – orta yaşdadır, cavanlıq ilə yaşlılıq arasındadır. Belə suallar verməyin. (افْعَلُوا مَا تُؤْمَرُونَ) - o şeylə ki, əmr olunubsunuz, onu yerinə yetirin.** (Bəni-İsrail bununla kifayət etməyib, ikinci dəfə sual verməyə başladı).

**69) (قَالُوا) – inək kəsməklə əmr olunanlar dedilər: (ادْعُ لَنَا رَبَّكَ)** – (ey Musa), **bizdən ötrü öz rəbbini çağır, (يُبَيِّنْ لَنَا) – ta ki bizdən ötrü bəyan və aşkar eləsin, (مَا لَوْنُهَا) - o inəyin rəngi nə rəngdir? (قَالَ) - Hz. Musa dedi: (اِنَّهُ يَقُولُ) - Allah-Təala buyurur: (اِنَّهَا بَقَرَةٌ) – o, bir inəkdir, (صَفْرَاءُ) - onun rəngi sarıdır. (فَاقِعٌ لَوْنُهَا) - rəngi son dərəcə sarıdır. (تَسُرُّ النَّاظِرِينَ) – elə sarıdır ki, ona baxanları şad edər.** (Tarixçi Vəhb ibn Münəbbih deyir: o inəyin rəngi elə sarı idi ki, ona baxanda zənn edərdin ki, günəşin şüası onun dərisindən çıxır).

**70) (قَالُوا)** – (inəyi kəsməklə əmr olunanlar 3-cü dəfə sual verib) **dedilər: (ادْعُ لَنَا رَبَّكَ)** – (ey Musa), **bizdən ötrü öz rəbbini çağır, (يُبَيِّنْ لَنَا) – ta ki bizdən ötrü bəyan və aşkar eləsin, (مَا هِيَ) - o inəyin əsl xüsusiyyəti və halı necədir? (اِنَّ الْبَقَرَ) - həqiqətən, o inək ki, onu kəsməklə əmr olunmuşuq, (تَشَابَهَ عَلَيْنَا) - o inək bizim üçün şübhəlidir** (qaranlıqdır. Nə xüsusiyyətdə və nə halda

**وَاِنَّٓا اِنْ شَٓاءَ اللّٰهُ لَمُهْتَدُونَ ﴿٧٠﴾ قَالَ اِنَّهُ يَقُولُ اِنَّهَا بَقَرَةٌ لَا ذَلُولٌ تُثٖيرُ الْاَرْضَ وَلَا تَسْقِي الْحَرْثَۚ مُسَلَّمَةٌ لَا شِيَةَ فٖيهَاۜ قَالُوا الْـٰٔنَ جِئْتَ بِالْحَقِّۜ فَذَبَحُوهَا وَمَا كَادُوا يَفْعَلُونَ ۟﴿٧١﴾ وَاِذْ قَتَلْتُمْ نَفْسًا فَادّٰرَءْتُمْ فٖيهَاۜ وَاللّٰهُ مُخْرِجٌ مَا كُنْتُمْ تَكْتُمُونَۚ ﴿٧٢﴾ فَقُلْنَا اضْرِبُوهُ بِبَعْضِهَاۜ كَذٰلِكَ يُحْيِ اللّٰهُ الْمَوْتٰى وَيُرٖيكُمْ اٰيَاتِهٖ**

---

bir inək kəsəcəyimiz bizə məlum deyil). **(وَاِنَّٓا اِنْ شَٓاءَ اللّٰهُ) - həqiqətən, biz, əgər Allah-Təalanın istəyi olsa, (لَمُهْتَدُونَ) - əlbəttə, o inəyi tapmaqda müvəffəq olub, hidayət taparıq.**

**71) (قَالَ) – Hz. Musa** (s.ə.s) **onların cavabında dedi: (اِنَّهُ يَقُولُ) - Allah-Təala buyurur: (اِنَّهَا بَقَرَةٌ) – o, elə bir inəkdir ki, (لَا ذَلُولٌ تُثٖيرُ الْاَرْضَ) – zəlil olmayıb işləmək səbəbilə, (وَلَا تَسْقِي الْحَرْثَ) - və əkin sulamayan, (necə ki digər inəkləri işlədib, əkinə su verirlər). (مُسَلَّمَةٌ) - hər bir eyib və nöqsandan uzaq, sağlamdır. (لَا شِيَةَ فٖيهَا) - o inəyin rəngində xüsusi bir rəng yoxdur. Xalis sarıdır. (قَالُوا) - dedilər:** (ey Musa), **(الْـٰٔنَ جِئْتَ بِالْحَقِّ) - haqq sözüylə gəlib indi inəyi bizdən ötrü yaxşı vəsf elədin. Bu vəsfdə inəyi taparıq. Ondan sonra axtarış edib, əvvəlcə qeyd edilən həmin cavandan bu vəsfdəki inəyi tapdılar. (فَذَبَحُوهَا) - o inəyi tapandan sonra kəsdilər. (وَمَا كَادُوا يَفْعَلُونَ) - amma az qalmışdı ki, o inəyi kəsməsinlər. Məcbur qalıb kəsdilər.** (İnəyi kəsməkdən qorxurdular ki, bəlkə, doğrudan da o meyit dirilər. O vaxt da onların qatil olması məlum olar. Buna görə də, inək məsələsində təəccüblə uzun sorğu-sual edib, bunda israr elədilər. Ta ki inəyi kəsmə işindən uzaqlaşa bilsinlər. Axırda bu, mümkün olmayıb inəyi kəsdilər).

**72) (وَاِذْ قَتَلْتُمْ نَفْسًا) – o zaman ki bir nəfəri qətlə yetirdiniz, o səbəbə görə inəyin kəsilməsilə əmr olundunuz. (فَادّٰرَءْتُمْ فٖيهَا) - o cavanı qətlə yetirəndən sonra onun qatilinin haqqında ixtilaf elədiniz. Bəyan və aşkar etmədiniz ki, onu kim qətlə yetirib. (وَاللّٰهُ مُخْرِجٌ) - halbuki Allah-Təala zahir və aşkar edəndir, (مَا كُنْتُمْ تَكْتُمُونَ) - o şeyi ki məxfi tutub gizlədirdiniz,** (insan öldürdüyünüzü gizlədirdiniz, halbuki Allah-Təala onu üzə çıxartdı).

**73) (فَقُلْنَا اضْرِبُوهُ بِبَعْضِهَا) – inəyi kəsəndən sonra Musa vasitəsilə onlara əmr eləyib dedik: o inəyin bir parçasını o meyitə vurun. Ta ki dirilib öz qatilini bəyan eləsin.** (İlahi əmr gələndən sonra Hz. Musanın əmri ilə o inəkdən bir parça kəsib meyitə vurdular. O meyit dirilib, öz əmisi oğlanlarının qatil olduğunu Hz. Musaya bəyan eləyib, yenidən öldü. Hz. Musa da onun qatillərini qətlə yetirdi). **(كَذٰلِكَ) - necə ki Allah-Təala o meyitə həyat verib, diriltdi, habelə (يُحْيِ اللّٰهُ الْمَوْتٰى) - Allah-Təala bütün ölənləri qiyamət günündə dirildəcəkdir. Bu meyitin dirilməsini görüb, nəyə görə qiyamət gününü inkar edirsiniz? (وَيُرٖيكُمْ اٰيَاتِهٖ) - Allah-Təala bu meyiti diriltməklə öz**

لَعَلَّكُمْ تَعْقِلُونَ ﴿٧٣﴾ ثُمَّ قَسَتْ قُلُوبُكُمْ مِنْ بَعْدِ ذٰلِكَ فَهِيَ كَالْحِجَارَةِ اَوْ اَشَدُّ قَسْوَةً

**möcüzələrini sizə göstərir. Allah-Təala bu meyidə həyat verdi ki, qiyamət günündə ikinci dəfə dirilməyi inkar etməyəsiniz. (لَعَلَّكُمْ تَعْقِلُونَ) - əlbəttə, gərək ağılla hərəkət eləyib, bunu dərk edəsiniz. Allah-Təala bir ölünü diriltməyə qadir olduğu kimi, bütün ölüləri diriltməyə də qadirdir.** (Sual: nəyə görə Allah-Təala o qatillərə inəyi kəsməyi əmr elədi və bununla o meyitə həyat verdi? Cavab: Allah-Təalanın bütün əməlləri hikmət üzrədir. Allah-Təala heç bir işi hikmətsiz etməz. Lakin əksər fellərinin hikməti bizə aydın deyildir. Allah bilir, bəlkə də, bu məqamda inəyin kəsilməsində bu hikmət var idi: o qatillərin həmin cavanı qətlə yetirməkdə məqsədləri onun atasının var-dövlətinə varis olmaq idi. Allah-Təala onların istəyinin əksini onlara verdi. Əvvəlcə inəyi kəsdirməklə onların bütün mallarını əllərindən aldı. Çünki inəyi baha qiymətə aldılar və nə qədər malları var idisə, o inəyə xərclədilər, inəyin sahibi olan cavan müflislikdən xilas olub mal-mülk sahibi oldu. Amma onlar müflis oldular, halbuki xəyalları zəngin olmaq idi və ikincisi – özləri də məhv olub, öldürüldülər. Digər bir hikmət: inək kəsilib öldürüldüyü halda, necə ola bilər ki, bir meyitin digər bir meyidə vurulmasından həyat meydana gəlsin? Məqsəd bu idi: xalq agah olsun ki, həqiqətən, o meyitə həyat verən Allah-Təaladır. İnəyin bir parçasını o meyitə vurmaq zahiri səbəbdir. Amma o səbəbin heç bir həqiqi təsiri yoxdur. Həqiqi təsiri olan səbəb Allah-Təaladır. "Heç bir səbəb olmadan səbəbləri yaradan Allahdır". Bəni-İsrail öz heyvani nəfslərinə tabe olub, ona müxtəlif qidalar verib qüvvətləndirməklə, məhv olan mübarək ağıllarını zillət və rəzillik içində qətlə yetirdilər. Allah-Təala tərəfindən Hz. Musa vasitəsilə əmr olundular ki, öz heyvani nəfslərini qətlə yetirib, onun qəzəb və şəhvət kimi bəzi orqanlarını mübarək ağla kömək üçün versinlər, ta ki xəbis rəqib (heyvani nəfs) aradan götürülərək mübarək ağıl yenidən həyat tapıb öz səltənətinə geri qayıtsın. Bəni-İsrail də o kamil sultanın tədbiri ilə bütün bəla və dərdlərdən xilas olsun).

**74) (ثُمَّ قَسَتْ قُلُوبُكُمْ مِنْ بَعْدِ ذٰلِكَ) - siz bəni-İsrail tayfası yuxarıda qeyd olunan ayələri görəndən sonra qəlbiniz elə sərtləşdi ki, heç bir şəkildə sizə öyüd-nəsihət* təsir etmir.**

*(*__Qeyd:__ Bu əhvalat Hz. Musanın zamanında vaqe olubdur, Allah-Təalanın bu əhvalatı qeyd etməkdə məqsədi uca peyğəmbərimizin (s.ə.s) zamanında olan yəhudilərə elan etməkdir ki, siz yəhudilərin işi həmişə inadkarlıq və itaətsizlikdir. Necə ki əcdadınız Hz. Musaya itaət etmədi, habelə siz də möhtərəm peyğəmbərimiz Hz. Məhəmmədə (s.ə.s) itaət edən deyilsiniz və heç bir ilahi ayə də sizə təsir edən deyildir və bu uca Quran ki, bütün ərəb ədibləri onun müqabilində aciz qalıblar, siz ibrət nəzəri ilə ona baxmırsınız ki, bəlkə, hidayət tapan şəxslərdən olasınız).*

**(فَهِيَ كَالْحِجَارَةِ) - sizin qəlbiniz daş kimidir. (اَوْ اَشَدُّ قَسْوَةً) – ya da şiddət və sərtlikdə daşdan möhkəmdir. Daşa dəmir təsir eləyib onu dağıdır. Amma**

وَاِنَّ مِنَ الْحِجَارَةِ لَمَا يَتَفَجَّرُ مِنْهُ الْاَنْهَارُ وَاِنَّ مِنْهَا لَمَا يَشَّقَّقُ فَيَخْرُجُ مِنْهُ الْمَآءُ وَاِنَّ مِنْهَا لَمَا يَهْبِطُ مِنْ خَشْيَةِ اللّٰهِ وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ ﴿٧٤﴾ اَفَتَطْمَعُونَ اَنْ يُؤْمِنُوا لَكُمْ وَقَدْ كَانَ فَرِيقٌ مِنْهُمْ يَسْمَعُونَ كَلَامَ اللّٰهِ ثُمَّ يُحَرِّفُونَهُ مِنْ بَعْدِ مَا عَقَلُوهُ وَهُمْ يَعْلَمُونَ﴿٧٥﴾ وَاِذَا لَقُوا الَّذِينَ اٰمَنُوا قَالُوٓا اٰمَنَّا

---

**sizin qəlbinizə dəmirdən möhkəm olan sözlər təsir eləmir.** (Bəli, insan axmaqlıq və cəhalət məqamında olanda nəiniki daş, bəlkə, dünyada heç bir şey o sərtlikdə olmayıb, dünyanın bütün müdrikləri və nəsihətçiləri ona öyüd-nəsihət eləsə də, ona təsir etməz, onun cəhalət və axmaqlığı azalmaz. Dünyada axmaqlıq və cəhalət kimi başqa bir xəstəlik yoxdur). **(وَاِنَّ مِنَ الْحِجَارَةِ) - həqiqətən, daşlardan, (لَمَا يَتَفَجَّرُ مِنْهُ الْاَنْهَارُ) - elə daş var ki, ondan çaylar, çeşmələr fışqırar, (وَاِنَّ مِنْهَا لَمَا يَشَّقَّقُ) - və həqiqətən, daşlardan elə daş var ki, paralanıb, (فَيَخْرُجُ مِنْهُ الْمَآءُ) ondan su çıxar,** (necə ki bəzən əsla su əlaməti olmayan daş paralanıb, ondan su fışqırar). **(وَاِنَّ مِنْهَا) - yenə həqiqətən, bəzi daşlardan, (لَمَا يَهْبِطُ مِنْ خَشْيَةِ اللّٰهِ) – elə daş var ki, uca dağların başından Allah-Təalanın qorxusu ilə** (zəlzələ və ya başqa səbəblə) **aşağıya düşər. (وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ) - o şeyləri ki, siz edirsiniz, Allah-Təala sizin o əməllərinizdən qafil olan deyildir.**

**75) (اَفَتَطْمَعُونَ اَنْ يُؤْمِنُوا لَكُمْ)** – (bu ayə peyğəmbərə və onun səhabələrinə xitabdır. Buyurur:) **siz yəhudiləri imana dəvət etməklə sizin dəvətinizi qəbul edib Qurana iman gətirmələrini arzu edirsiniz? (وَقَدْ كَانَ فَرِيقٌ مِنْهُمْ) - halbuki o yəhudilərin elə üləmaları var idi ki, (يَسْمَعُونَ كَلَامَ اللّٰهِ) - Tövratda qeyd olunan Allah-Təala kəlamını eşidirdilər, (ثُمَّ يُحَرِّفُونَهُ مِنْ بَعْدِ مَا عَقَلُوهُ) - o ilahi kəlamı tam anlayıb, yadda saxlayandan sonra onu dəyişdirib, öz nəfsani istəklərinə görə, Allah-Təalanın kəlamına başqa mənalar verirdilər. Belə şəxslərin imana daxil olmasına necə ümid etmək olar? (وَهُمْ يَعْلَمُونَ) - halbuki özləri buna agah idilər ki, Allah-Təalanın kəlamını dəyişdirib, ona yalandan iftira eləyirlər. Bu yəhudi tayfasının Allah-Təala tərəfindən gələn ayələri inkar etməsi onların qədim adətləridir. O səbəbdən Quranı da inkar etdilər. Daha onların imana daxil olmasını ümid etməyin.** (Allah-Təala gələn ayədə yəhudilərin münafiq* olduqlarını bəyan edir ki, münafiq şəxsdən heç bir xeyir əməl meydana gəlməyəcəyinə görə, onların imana daxil olması ümidindən möminlər vaz keçsinlər).

*(*Qeyd: Zahiri batini ilə müvafiq olmayan şəxsə münafiq deyilir).*

**76) (وَاِذَا لَقُوا الَّذِينَ اٰمَنُوا)** – (ey Məhəmməd), **bu münafiqlərin xüsusiyyəti budur: o zaman ki iman izhar edən münafiq yəhudilər möminlərlə qarşılaşdılar, (قَالُوٓا اٰمَنَّا) - möminlərə dedilər: biz də sizin kimi, Qurana iman gətirib Məhəmmədi təsdiq eləmişik. Bu Məhəmməd həmin peyğəmbərdir**

وَاِذَا خَلَا بَعْضُهُمْ اِلٰى بَعْضٍ قَالُوٓا اَتُحَدِّثُونَهُمْ بِمَا فَتَحَ اللّٰهُ عَلَيْكُمْ لِيُحَآجُّوكُمْ بِهٖ عِنْدَ رَبِّكُمْ ۜ اَفَلَا
تَعْقِلُونَ﴿٧٦﴾ اَوَلَا يَعْلَمُونَ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا يُسِرُّونَ وَمَا يُعْلِنُونَ ﴿٧٧﴾

---

**ki, Allah-Təala Tövratda xəbər veribdir. (وَاِذَا خَلَا بَعْضُهُمْ اِلٰى بَعْضٍ) – o zaman ki yəhudilərdən bəzisi** (iman izhar edənlər) **digərləri ilə** (iman izhar etməyənlərlə) **təkbətək qaldılar, (قَالُوٓا): yəhudilərdən iman izhar etməyənlər edənlərə məzəmmətlə dedilər: (اَتُحَدِّثُونَهُمْ) – bəs möminlərdən ötrü danışırsınız, (بِمَا فَتَحَ اللّٰهُ عَلَيْكُمْ) - o sözləri ki, Allah-Təala sizdən ötrü Tövratda o sözləri açıb bəyan edibdir, (لِيُحَآجُّوكُمْ بِهٖ عِنْدَ رَبِّكُمْ) – ta ki, möminlər həmin sözlərlə ki, Allah-Təala sizə Tövratda nazil eləyibdir, sizinlə mübahisə eləyib desinlər: özünüz deyirsiniz ki, Allah-Təala Məhəmmədin haqq olmağını Tövratda xəbər veribdir. Bəs niyə iman gətirmirsiniz? Bu sözləri möminlər sizə deyib, məğlub olursunuz. (اَفَلَا تَعْقِلُونَ) – bəs ağlınız ilə bunu dərk etmirsiniz ki, belə bir sözü danışmaqdan sizə ziyan dəyir, məğlub olursunuz, gərək belə söz danışmayasınız.** (O zaman ki yəhudilərin münafiqləri möminlərə dedilər: biz də sizin kimi, Qurana iman gətirmişik, bu Məhəmməd həmin şəxsdir. Allah-Təala onun vəsfini Tövratda bizə xəbər veribdir. O vaxt da yəhudilərdən bu kəlamı deməyənlər onlara məzəmmətlə dedilər: nədən ötrü bu kəlamı möminlərə deyirsiniz? Bu kəlamın sizə zərəri vardır. Çünki mübahisə və münaqişə məqamında sizin öz kitabınızda olan sözləri möminlər dəlil gətirib sizə deyirlər: nə səbəbə görə Məhəmmədi inkar edirsiniz? Bu həmin şəxsdir ki, sizin kitabda onun xüsusiyyətləri bəyan olunubdur. Necə ki özünüz bu mətləbə iqrar elədiniz. Möminlər bu sözləri sizə deyəndə məğlub olursunuz). **Gələn ayədə Allah-Təala o yəhudilərin o sözünü rədd edib, onların münafiq olmasını bəyan edir.**

**77) (اَوَلَا يَعْلَمُونَ) - yəhudilər bir-biriləri ilə xəlvətdə belə sözlər danışırlar, guya Allah-Təala onlardan qafildir, bəs bilmirlər bunu ki, (اَنَّ اللّٰهَ يَعْلَمُ) - həqiqətən, Allah-Təala agahdır. (مَا يُسِرُّونَ) - hər nəyi ki, gizlədirlər,** (batində yəhudi olduqlarını), **(وَمَا يُعْلِنُونَ) - və hər nəyi ki, onu aşkar edirlər,** (iman izhar edib deyirlər: biz də siz möminlər kimi iman gətirmişik)**. Allah-Təala agahdır ki, onlar yalan deyirlər.** (Bu, uca peyğəmbərimizdən ötrü bir möcüzədir ki, yəhudilərin batinlərini və bir-biriləri ilə olan söhbətlərini onlara xəbər verdi). Əvvəlki ayələr yəhudi üləması barəsində nazil olubdur. Gələn ayə isə avam yəhudilər barəsində nazil olubdur. Allah-Təala elan edir ki, yəhudilərin üləması və avamları hamısı zəlalətdə və əzabda olacaqdır, amma alim gərək elminə əməl etsin, onlar elmlərinə əməl etməyib, əzaba haqq qazandılar. Amma avam gərək dinin əsl hökmlərində üləmanı təqlid etməsin, onlardan ötrü elm mümkün olan halda, elmi tərk, üləmaları təqlid edib, Quranı inkar etdilər, halbuki Hz. Peyğəmbərin zamanında yaşadıqlarına görə, onun haqq olduğunu öyrənmələri mümkün idi. Elmi tərk etdilər, təqlidlə kifayətləndilər,

وَمِنْهُمْ اُمِّيُّونَ لَا يَعْلَمُونَ الْكِتَابَ اِلَّا اَمَانِيَّ وَاِنْ هُمْ اِلَّا يَظُنُّونَ ﴿٧٨﴾ فَوَيْلٌ لِلَّذِينَ يَكْتُبُونَ الْكِتَابَ بِاَيْدِيهِمْ ثُمَّ يَقُولُونَ

---

zəlalətlərinə davam etdilər. Üləmaları təqlid etdikləri üçün Quranı inkar etmiş oldular. Avamdan ötrü elm mümkün olan halda, dinin əsl hökmlərində üləmanı təqlid etmək caiz deyildir. Üləmanı təqlid etmək ancaq dinin ikinci dərəcəli məsələlərinə aiddir. Amma bizim zəmanənin heyvan təbiətli avamları üləma paltarında olan hər kəsin dalınca qaçır, hərçənd o üləmalar islam dininə xilaf hökmləri onlara təlim edirlər. Qurana xilaf hökmləri təklif edib, qəbul edənləri möhtərəm sayıb, Quran ehkamına dəvət edənlərdən üz döndərirlər. Bundan artıq cəhalət və axmaqlıq olarmı?)

**78) (وَمِنْهُمْ اُمِّيُّونَ) - bəzi yəhudilər var ki, yazmaq və oxumaq bilməzlər, (لَا يَعْلَمُونَ الْكِتَابَ) - Tövratı bilməzlər, (اِلَّا اَمَانِيَّ) - ancaq öz arzularına müvafiq (arzuları bu idi ki, bizi Allah-Təala bağışlayar, çünki biz peyğəmbər övladıyıq, babalarımız bizdən ötrü şəfaət eləyib, cəhənnəmə daxil olmarıq). (وَاِنْ هُمْ اِلَّا يَظُنُّونَ) – yəhudilər bu arzularında ancaq güman içində olub, qəti bilmirlər, öz zənnləriylə bu arzunu edirlər.* Yəni zənn və güman eləyib deyirlər: biz peyğəmbər övladı olduğumuza görə, Allah-Təala bizə əzab etməz. Onların bu sözləri batildir. Allah-Təala yanında soy-nəsəb mötəbər olmayıb, yaxşı əməl və təmiz qəlb lazımdır. Gələn ayədə Allah-Təala yəhudilərin əməllərinə görə, onlara əzab edəcəyini bəyan edir.**

*(***Qeyd:** *Sual: bu ayənin hökmü ancaq bəni-İsrailə məxsusdur, yoxsa biz Quran əhlini də ehtiva edir? Cavab: Quran bizdən ötrü nazil olubdur, Quranda qeyd olunan qissə və hekayələr bizdən ötrü qeyd olunubdur. Ta ki o hekayələrdən agah olub ibrət alaq. Bəni-İsrail ancaq özlərinin qiyamət günündə nicat tapacaqlarını zənn edib, amma qəti bilmirdilər. Amma bizim dövrümüzdəki ələvilər (seyidlər) nəinki özlərinin nicat tapacağını, hətta digər şəxslərdən ötrü də şəfaət edəcəklərinə inanıb, Qurani-Şərifi təkzib edirlər. Özlərindən bir milçəyin əziyyətini dəf etməyə qadir olmayıb, özgələrdən ötrü ağızlarının tüpürcəyini, hətta əllərinin dəstəmaz suyunu öldürücü xəstəliklərə şəfa deyib, öz ayaqlarının toz-torpağını xalqın gözünə sürmə kimi çəkdirib, bu yolla xeyli miqdarda dünya malı yığırlar. Heyvan təbiətli avam xalq isə "həqiqətən, biz sizi bir kişi və bir qadından yaratdıq" ayəsindən qafil olub, Allah-Təaladan üz döndərib, adlarını müvəhhid qoyub bütpərəstliyi özlərinə şüar ediblər. Bu xüsusiyyətləri ancaq ələvilərdən ötrü qeyd elədim. Hətta fiqh və fiqh üsulu elmlərindən agah olan şəxslər (hansı ki fiqh və üsulu məsul olduğumuz fellərlə əlaqəli bir elmdir), özlərini uca peyğəmbərin vəkili hesab eləyib o həzrətin demədiyi sözləri bu cənablar iddia edib, özlərini bütün xalqa şəfaətçi sayırlar. Biz islam ümməti Qurani-Şərifin ayələrindən heç ibrət almırıq, halbuki Qurani- şərifin hekayələri çox incəlikləri və dəqiq hikmətləri ehtiva edir).*

**79) (فَوَيْلٌ لِلَّذِينَ)** - ("veyl" kəlməsi ərəb dilində əzab mənasındadır)**, əzab olsun o şəxslərə ki, (يَكْتُبُونَ الْكِتَابَ) - Tövratda qeyd olunan hökmlərin mənasını dəyişdirib yazırlar, (بِاَيْدِيهِمْ) - öz əlləri ilə, (ثُمَّ يَقُولُونَ) - ondan sonra avam in-**

هٰذَا مِنْ عِنْدِ اللّٰهِ لِيَشْتَرُوا بِه ثَمَنًا قَلِيلًاۜ فَوَيْلٌ لَهُمْ مِمَّا كَتَبَتْ اَيْدِيهِمْ وَوَيْلٌ لَهُمْ مِمَّا يَكْسِبُونَ ﴿٧٩﴾
وَقَالُوا لَنْ تَمَسَّنَا النَّارُ اِلَّا اَيَّامًا مَعْدُودَةًۜ قُلْ اَتَّخَذْتُمْ عِنْدَ اللّٰهِ عَهْدًا فَلَنْ يُخْلِفَ اللّٰهُ عَهْدَهُ اَمْ تَقُولُونَ
عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ ﴿٨٠﴾

---

**sanlara deyirlər ki, (هٰذَا مِنْ عِنْدِ اللّٰهِ) - bu hökm Allah-Təala tərəfindən nazil olan hökmdür.** (Tövratı buna görə dəyişdirirlər ki,) **(لِيَشْتَرُوا بِه ثَمَنًا قَلِيلًا) - avam xalqı aldadıb o dəyişdirdikləri hökmlə onlardan bir az pul* alsınlar. (فَوَيْلٌ لَهُمْ مِمَّا كَتَبَتْ اَيْدِيهِمْ) - Tövratın hökmünü dəyişdirib, əlləriylə yazdıqları hökmə görə onlara əzab olsun. (وَوَيْلٌ لَهُمْ مِمَّا يَكْسِبُونَ) - yenə yazdıqları hökm ilə qazandıqları mala görə onlara əzab** olsun.**

*(*Qeyd:* *Avam xalqın arzusuna görə, ilahi hökmü dəyişdirib bəyan edən şəxsə avamlar daha çox meyil etdikləri üçün yəhudi alimləri Tövratın hökmünü dəyişdirib, onların arzusu ilə hərəkət edirdilər. Necə ki bizim bu zamanımızda özünü alim sayan şəxslər Qurani-Şərifin ayələrini avamın istədiyi şəkildə yozub, ya da Quran ehkamını birdəfəlik kənara qoyub, nəfsani arzularla danışıb, avam xalqa təlim eləyəndə avamlar da tamamən onlara meyil edib onları peyğəmbərin vəkili hesab edirlər. Əgər bir alim Qurani-Şərifin ayəsini necə ki Allah-Təala istəyir, onlara izah etsə, qoyun qurddan, ya ulaq şirdən hürküb qaçan kimi, o şəxsdən qaçıb, üz döndərərlər. Bu mətləb bizim zamanımızda son dərəcə aşkardır. Allah-Təaladan xahiş edirik ki, bizi düz yola hidayət eləsin).*

*(**Qeyd:* *Bu ayədən hasil olan məna budur ki, yəhudi üləmasından ötrü 3 qisim əzab vardır. Birincisi – ilahi ehkamı dəyişdirib, onun yerinə ayrı ehkam yazmaqdan ötrü, ikincisi - o ehkamı Allah-Təalaya isnad etməkdən ötrü, üçüncüsü - o ehkamla dünya malı qazanmaqdan ötrü. Yəhudi üləmasının qissəsinin və onlara Tövratın ehkamını dəyişdirmələrinə görə əzab vəd edilməsinin Qurani-Şərifdə bəyan edilməsinin məqsədi islam ümmətini də xəbərdar etməkdir. (Yəni siz islam üləması gərək yəhudi üləmaları kimi Qurani-Şərifin ehkamını dəyişdirib, avam xalqın rəyinə tabe olmayasınız. Əlbəttə, islam üləması Allah-Təalanın nəsihətini qəbul eləyib, Quranın ehkamını heç cür dəyişdirməyib. Əksinə, Quranın ehkamına heç diqqət etməyib, uydurma xəbərləri özlərindən ötrü ehkam ediblər. İslam ümməti arasında da dini ehkam haqqında olan ixtilaflar bu mətləbə açıq sübutdur).*

**80) (وَقَالُوا لَنْ تَمَسَّنَا النَّارُ) - yəhudilər dedilər: Allah-Təala bizə cəhənnəm odunda əzab etməz. (اِلَّا اَيَّامًا مَعْدُودَةً) - bizim ata-babalarımız peyğəmbər olduğuna görə, nə qəbih əməl etsək də, bağışlayıb əzab etməz. Ancaq bir neçə gün** (əzab edər)**.** (40 gün və ya 7 gün, müxtəlif rəvayətlər var). **Bax gör ki, Allah-Təala onların cavabında nə buyurur, (قُلْ) –** (ey Məhəmməd), **onlara de: (اَتَّخَذْتُمْ عِنْدَ اللّٰهِ عَهْدًا) – bəlkə, Allah-Təalanın yanında vəd alıbsınız ki, sizə əzab etməsin? (فَلَنْ يُخْلِفَ اللّٰهُ عَهْدَهُ) - əgər Allah-Təalanın yanında vəd alıbsınızsa, əlbəttə, Allah-Təala əhdinə xilaf etməyib vəfa edər. (اَمْ تَقُولُونَ عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ) - ya da Allah-Təalaya o şeyi deyib, isnad edirsiniz ki, ona**

بَلٰى مَنْ كَسَبَ سَيِّئَةً وَاَحَاطَتْ بِهٖ خَطٖيٓئَتُهُ فَاُولٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فٖيهَا خَالِدُونَ ﴿٨١﴾ وَالَّذٖينَ
اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ اُولٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِۚ هُمْ فٖيهَا خَالِدُونَ ﴿٨٢﴾ وَاِذْ اَخَذْنَا مٖيثَاقَ بَنٖيٓ
اِسْرَآءٖيلَ لَا تَعْبُدُونَ اِلَّا اللّٰهَ وَبِالْوَالِدَيْنِ اِحْسَانًا وَذِي الْقُرْبٰى وَالْيَتَامٰى وَالْمَسَاكٖينِ وَقُولُوا لِلنَّاسِ حُسْنًا

---

**agah deyilsiniz.** (Gələn ayə yəhudilərin bu iddialarının batin olduğunu bəyan edir)**.**

**81) (**بَلٰى**) – xeyr, (bu söz ərəb dilində əvvəlcə keçən kəlamı batil edir. Yəhudilərin bu iddiaları batildir, əlbəttə, onlara öz əməllərinin müqabilində əzab olunacaqdır. Peyğəmbər övladı olmaq onlara fayda verməz. Bu dövrdə peyğəmbər nəslindən olanlar bu ayədən qafil olub özlərindən ötrü Allah-Təala yanında bir qədir-qiymət qərar verib, yəhudilər kimi özlərinin nicat tapacaqlarına inanıblar. Ondan sonra buyurur: nəinki yəhudilərə, hətta hər bir günah sahibinə əzab olunacaqdır). (**مَنْ كَسَبَ سَيِّئَةً**) - kim ki günah qazanır, (**وَاَحَاطَتْ بِهٖ خَطٖيٓئَتُهُ**) – və onun xəta və günahları hər bir tərəfdən onu əhatə edir, (**فَاُولٰٓئِكَ اَصْحَابُ النَّارِ**) - o şəxslər cəhənnəm odunun yoldaşlarıdır, (**هُمْ فٖيهَا خَالِدُونَ**) - onlardır, əlbəttə, cəhənnəm odunda həmişəlik qalanlar, oradan xilas olub qurtulmaq mümkün deyildir.** (Əvvəlki ayədə günahkarlara əzab vədi verdi. Gələn ayədə xeyir əməl edən möminlərin əcr, savabını bəyan edir).

**82) (**وَالَّذٖينَ اٰمَنُوا**) - o şəxslər ki,** (Qurani-Şərifə və Hz. Məhəmmədə (s.ə.s)) **iman gətiriblər, (**وَعَمِلُوا الصَّالِحَاتِ**) - və xeyir əməl eləyiblər, (**اُولٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِ**) - o şəxslər cənnət yoldaşlarıdır, (**هُمْ فٖيهَا خَالِدُونَ**) - əlbəttə, onlar behiştdə həmişəlik qalıb, oradan heç vaxt çıxan deyillər.** (Bu ayədən məlum olur ki, tək iman insana fayda verməz, imanla birlikdə əməl də gərək olsun. Bəni-İsrail əhvalatında onların soy-nəsəbləri ilə qürrələnib, əzabdan nicat tapacaqlarına inanmaları iddiasının batil olduğunu qeyd edib, cənnət və cəhənnəmin əmələ görə olacağını bəyan edəndən sonra gələn ayədə bəni-İsrailə xitab eləyib onların xüsusiyyətini göstərir).

**83) (**وَاِذْ اَخَذْنَا**) - yadınıza salın,** (ey bəni-İsrail)**, o zaman ki, aldıq, (**مٖيثَاقَ بَنٖيٓ اِسْرَآءٖيلَ**) - bəni-İsraildən əhd,** (yəni sizin ata-babalarınızın möhkəm olan əhdini)**, onlardan möhkəm əhd alıb Hz. Musa vasitəsilə onlara dedik: (**لَا تَعْبُدُونَ اِلَّا اللّٰهَ**) - Allah-Təaladan başqa, heç bir şeyə ibadət etməyin. (**وَبِالْوَالِدَيْنِ اِحْسَانًا**) - ata və analarınıza yaxşılıq eləyin. (**وَذِي الْقُرْبٰى**) - habelə yaxşılıq eləyin soy-nəsəb cəhətdən sizə yaxın olan şəxslərə, (**وَالْيَتَامٰى**) – yetimlərə, (**وَالْمَسَاكٖينِ**) - yoxsullara, (**وَقُولُوا لِلنَّاسِ حُسْنًا**) - bütün insanlara gözəl və yaxşı söz deyib danışın.** (Allah-Təala bütün insanlarla gözəl rəftar etməyi biz müsəlmanlara əmr edir. İnsanların bir-biri ilə münasibətlərində gözəl rəftar ilk şərtdir. Qurani-Şərifin nəsihətləri nə gözəl və uca kəlamlardır, amma dərk

وَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ ۗ ثُمَّ تَوَلَّيْتُمْ اِلَّا قَلِيلًا مِنْكُمْ وَاَنْتُمْ مُعْرِضُونَ ﴿٨٣﴾ وَاِذْ اَخَذْنَا
مِيثَاقَكُمْ لَا تَسْفِكُونَ دِمَاۤءَكُمْ وَلَا تُخْرِجُونَ اَنْفُسَكُمْ مِنْ دِيَارِكُمْ ثُمَّ اَقْرَرْتُمْ وَاَنْتُمْ تَشْهَدُونَ ﴿٨٤﴾

---

eləyib, yadda saxlayan çox azdır). (وَاَقِيمُوا الصَّلٰوةَ) **- və namazı həmişə qılın,** (وَاٰتُوا الزَّكٰوةَ) **- malınızdan zəkatı çıxarıb verin.** (ثُمَّ تَوَلَّيْتُمْ) **- Bu əhdi siz bəni-İsraildən alandan sonra əhdi pozub, qeyd olunan ehkamlara arxanızı döndünüz.** (اِلَّا قَلِيلًا مِنْكُمْ) **– ancaq sizin çox azınız əhdlərinə sadiq qaldı.** (وَاَنْتُمْ مُعْرِضُونَ) **- siz bəni-İsrail elə bir tayfasınız ki, adətiniz həmişə əhddən üz döndərib, arxa çevirməkdir.**

**84)** (وَاِذْ اَخَذْنَا مِيثَاقَكُمْ) **- yadınıza salın,** (ey bəni-İsrail)**, o zaman ki sizdən möhkəm əhd aldıq,** (bu əhddən və bundan əvvəl keçən əhddən məqsəd həmin hökmlərdir ki, Allah-Təala Tövratda Hz. Musanın vasitəsilə yəhudilərə göndərmişdi. Onlar da qəbul elədilər ki, o ehkama əməl etsinlər, necə ki ayədə qeyd olunur)**,** (لَا تَسْفِكُونَ دِمَاۤءَكُمْ) **- o sözü sizdən aldıq ki, bir-birinizi qətlə yetirib qan tökməyəsiniz,** (وَلَا تُخْرِجُونَ اَنْفُسَكُمْ مِنْ دِيَارِكُمْ) **– özünüz kimi olan din qardaşlarınızı sizinlə bir yerdə yaşadıqları məkanlarınızdan çıxarmayasınız.** (Yəni siz güclü olan şəxslər zəif olanlara zülm eləyib, onları sizinlə bir yerdə yaşadıqları məkandan çıxartmayın)**.** (ثُمَّ اَقْرَرْتُمْ) **- bu sözü sizdən alandan sonra bu əhdi qəbul etdiniz.** (وَاَنْتُمْ تَشْهَدُونَ) **–siz şəhadət etdiniz ki,** (təsdiq etməklə)**, bizdən bu əhd alınıbdır.** (Allah-Təala bundan sonra gələn ayədə yəhudi camaatının bəzi qissələrinə və onların Tövrat ehkamına müxalifət etmələrinə işarə edir, ta ki biz müsəlmanlar da onlardan ibrət alıb, Qurani-Şərifin ehkamına müxalifət etməyək. Bizim bu zamanda Qurani-Şərifin ehkamının bizim aramızda işlənmədiyindən xəbərdar olduq. Əvvəlcə gərək o qissəni müxtəsər şəkildə bəyan eləyib, ondan sonra ayənin mənasını izah edək. Ta ki bu təfsirə baxanlar ayənin mənasına agah olsunlar. Mədinədə iki tayfa var idi. Birinə Evs, o birisinə Xəzrəc deyilirdi. Mədinə ətrafında olan yəhudilərin iki böyük tayfası var idi. Biri Bəni-Qüreyzə, o birisi Bəni-Nəzir. Mədinə əhli olan bu iki tayfa (Evs və Xəzrəc) həmişə bir-biri ilə savaşardılar, yəhudilərdən bəni-Qüreyzə Evs tayfasıyla, bəni-Nəzir Xəzrəc tayfasıyla müttəfiq idi. Savaşda hər tayfa öz müttəfiqinə kömək eləyib, öz din qardaşlarına və düşmən yəhudilərə qarşı savaşıb, bir-birilərini qətlə yetirərdilər. Biri digərinə qalib olanda onları evlərindən qovub, mənzillərini viran edərdilər. Amma əgər Evs, ya da Xəzrəc yəhudilərdən bir nəfəri əsir etsəydi, o tayfanın müttəfiqi olan yəhudilər o əsirin əvəzində bir şeylər verib, onu alıb azad edərdilər. Ərəblər yəhudilərə məzəmmət edib dedilər: bu necə əməldir ki, edirsiniz? Savaş məqamında öz yəhudi qardaşlarınızı qətlə yetirirsiniz, amma əsir olanda onları alıb azad eləyirsiniz? Yəhudilər dedilər: Allah-Təala Tövratda əsirləri azad etməyi bizə əmr edibdir, habelə öz din qardaşlarımızla savaşma-

ثُمَّ اَنْتُمْ هٰٓؤُلَٓاءِ تَقْتُلُونَ اَنْفُسَكُمْ وَتُخْرِجُونَ فَرِيقًا مِنْكُمْ مِنْ دِيَارِهِمْ ۘ تَظَاهَرُونَ عَلَيْهِمْ بِالْاِثْمِ
وَالْعُدْوَانِ وَاِنْ يَأْتُوكُمْ اُسَارٰى تُفَادُوهُمْ وَهُوَ مُحَرَّمٌ عَلَيْكُمْ اِخْرَاجُهُمْ ۜ اَفَتُؤْمِنُونَ بِبَعْضِ الْكِتَابِ
وَتَكْفُرُونَ بِبَعْضٍ ۚ فَمَا جَزَٓاءُ مَنْ يَفْعَلُ ذٰلِكَ مِنْكُمْ اِلَّا خِزْيٌ فِي الْحَيٰوةِ الدُّنْيَا ۚ وَيَوْمَ الْقِيٰمَةِ يُرَدُّونَ
اِلٰٓى اَشَدِّ الْعَذَابِ ۜ وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ ﴿٨٥﴾ اُولٰٓئِكَ الَّذِينَ اشْتَرَوُا الْحَيٰوةَ الدُّنْيَا بِالْاٰخِرَةِ ۘ

---

ğı bizə haram edib, amma müttəfiqlərimizdən utandığımız üçün bir-birimizlə savaşmaqdan başqa çarəmiz yoxdur. Allah-Təala gələn ayədə yəhudilərin küfr və nifaqını və Tövrata zidd əməl etdiklərini bəyan edir. İndi ayənin mənasına başlayaq).

**85) (ثُمَّ اَنْتُمْ هٰٓؤُلَٓاءِ) - siz bəni-İsraildən o sözü alandan sonra, (تَقْتُلُونَ اَنْفُسَكُمْ) – bir-birinizlə savaşıb, özünüz kimi olan şəxsləri qətlə yetirirsiniz. Necə ki qeyd olundu, bəni-Qüreyzə Evsə, bəni-Nəzir Xəzrəcə kömək edib, bir-biriləri ilə savaşırdılar. (وَتُخْرِجُونَ فَرِيقًا مِنْكُمْ مِنْ دِيَارِهِمْ) – bir-birinizlə savaşıb qalib olandan sonra özünüzdən olan bir camaatı** (yəni məğlub olan camaatı) **öz məskən və məkanlarından qovursunuz. (تَظَاهَرُونَ عَلَيْهِمْ بِالْاِثْمِ وَالْعُدْوَانِ) - günah və zülm səbəbi ilə onları öz yurdlarından qovmaqdan ötrü bir-birinizdən kömək istəyirsiniz. (وَاِنْ يَأْتُوكُمْ اُسَارٰى) - amma əgər o din qardaşlarınızdan kimsə əsirlik halında sizin tərəfə gəlsə, (تُفَادُوهُمْ) - o vaxt da onlardan ötrü əvəz verib, onları alıb azad eləyirsiniz.** (Onlar həmin şəxslərdir ki, onlara qalib gələndə evlərindən qovurdunuz). **(وَهُوَ مُحَرَّمٌ عَلَيْكُمْ اِخْرَاجُهُمْ) - və halbuki onları evlərindən qovmaq** (Tövratda) **sizə haram edilibdir. (اَفَتُؤْمِنُونَ بِبَعْضِ الْكِتَابِ) - bəs Tövratın bəzi ehkamına** (əsiri alıb azad etməyə) **iman gətirirsiniz, (وَتَكْفُرُونَ بِبَعْضٍ) - amma digər bəzisini** (onları mənzillərindən qovmağa) **inkar edirsiniz? Halbuki hər ikisi Tövratın ehkamıdır, birinə iman gətirib, o birini inkar etmək hamısını inkar etmək kimidir.** (Qurani-Şərifin ehkamı da belədir, Qurani-Şərifin bütün hökmlərinə əməl eləyib bir hökmünü inkar etmək hamısını inkar etmək kimidir). **(فَمَا جَزَٓاءُ مَنْ يَفْعَلُ ذٰلِكَ مِنْكُمْ اِلَّا خِزْيٌ فِي الْحَيٰوةِ الدُّنْيَا) - siz bəni-İsraildən Tövratın bəzi ehkamlarına iman gətirib, bəzilərini inkar edənlərin cəzası ancaq dünya həyatında zəlil və həqir olub, əzaba düçar olmaqdır.** (Hökm sahibi peyğəmbərimizin əmri ilə bəni-Nəzir tayfasını Mədinədən qovmaq və Sə`d ibn Muazın hökmüylə bəni-Qüreyzənin savaşan kişilərini qətlə yetirib, qadınlarını və uşaqlarını əsir etmək dünya əzabıdır. İnşallah, bu əhvalat öz məqamında qeyd olunacaqdır). **(وَيَوْمَ الْقِيٰمَةِ يُرَدُّونَ اِلٰٓى اَشَدِّ الْعَذَابِ) - dünya əzabından sonra qiyamət günündə Allah-Təala onları şiddətli olan od əzabına tərəf qaytarar. (وَمَا اللّٰهُ بِغَافِلٍ) - Allah-Təala qafil olan deyil, (عَمَّا تَعْمَلُونَ) - siz yəhudilərin etdiyi şeylərdən.**

**86) (اُولٰٓئِكَ) - o bəni-Qüreyzə və bəni-Nəzir yəhudiləri, (الَّذِينَ اشْتَرَوُا الْحَيٰوةَ الدُّنْيَا بِالْاٰخِرَةِ) - elə şəxslərdir ki, dünyanı axirətə qarşılıq alıb, axirəti dünya-**

فَلَا يُخَفَّفُ عَنْهُمُ الْعَذَابُ وَلَا هُمْ يُنْصَرُونَ ﴿٨٦﴾ وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ وَقَفَّيْنَا مِنْ بَعْدِهٖ
بِالرُّسُلِ وَاٰتَيْنَا عِيسَى ابْنَ مَرْيَمَ الْبَيِّنَاتِ وَاَيَّدْنَاهُ بِرُوحِ الْقُدُسِ اَفَكُلَّمَا جَٓاءَكُمْ رَسُولٌ بِمَا لَا تَهْوٰٓى
اَنْفُسُكُمُ اسْتَكْبَرْتُمْ فَفَرِيقًا كَذَّبْتُمْ وَفَرِيقًا تَقْتُلُونَ ﴿٨٧﴾ وَقَالُوا قُلُوبُنَا غُلْفٌ بَلْ لَعَنَهُمُ اللّٰهُ بِكُفْرِهِمْ
فَقَلِيلًا مَا يُؤْمِنُونَ ﴿٨٨﴾ وَلَمَّا جَٓاءَهُمْ كِتَابٌ مِنْ عِنْدِ اللّٰهِ مُصَدِّقٌ لِمَا مَعَهُمْ وَكَانُوا مِنْ قَبْلُ

---

**ya satıblar. (فَلَا يُخَفَّفُ عَنْهُمُ الْعَذَابُ) - onların bu əməllərinə görə onların əzabı azaldılmaz. (وَلَا هُمْ يُنْصَرُونَ) - və heç kim onlara kömək eləyə bilməz.**

**87) (وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ) - həqiqətən, biz Musaya Tövratı verdik, (وَقَفَّيْنَا مِنْ بَعْدِهٖ بِالرُّسُلِ) - Musadan sonra çox peyğəmbərlər göndərdik.** (Samuel (İşmoil), Yuşa, Şimon, Davud, Süleyman, Şüeyb, Yeremya, Üzeyir, Həzkiyel, İlyas, Elisa, Zül-Kəfl, Yunis, Zəkəriyya, Yəhya) **və bunlardan başqa peyğəmbərlər. (وَاٰتَيْنَا عِيسَى ابْنَ مَرْيَمَ الْبَيِّنَاتِ) - İsa Məryəm oğluna möcüzələr verdik. (وَاَيَّدْنَاهُ بِرُوحِ الْقُدُسِ) - ona pak və müqəddəs olan ruhla qüvvət verdik.** (Onun ruhunu pak və müqəddəs etdik ki, hər bir şeyin elmi ondan ötrü kəşf olunsun.) **(اَفَكُلَّمَا جَٓاءَكُمْ رَسُولٌ) - ey Bəni-İsrail, nə zaman ki bizim tərəfimizdən sizə bir peyğəmbər gəldi, (بِمَا لَا تَهْوٰٓى اَنْفُسُكُمُ اسْتَكْبَرْتُمْ) – sizin arzunuza uyğun olmayan bir kitab və ya bir möcüzə ilə o vaxt da təkəbbürlənib, ona itaət etmədiniz. (فَفَرِيقًا كَذَّبْتُمْ) - o peyğəmbərlərdən bir qrupu təkzib eləyib, dediklərini qəbul etmədiniz** (Nuh, İbrahim, Musa, İsa və Hz. Məhəmmədi təkzib elədilər). **(وَفَرِيقًا تَقْتُلُونَ) - və peyğəmbərlərdən digər bir qrupu qətlə yetirdiniz** (Şüeyb, Zəkəriyyə və Yəhyanı qətlə yetirdilər). Yəhudilərin adəti peyğəmbərləri ya təkzib etmək, ya da qətlə yetirmək idi).

**88) (وَقَالُوا) - yəhudilər dedilər: (قُلُوبُنَا غُلْفٌ) - bizim qəlblərimiz örtülü və pərdəlidir. Allah-Təala bizim qəlblərimizi belə yaradıbdır. Ona görə də (Hz. Məhəmmədin** (s.ə.s) **dediyi sözlər bizim qəlbimizə daxil olmur. (Allah-Təala yəhudilərin bu dediklərini rədd edib buyurur: (بَلْ لَعَنَهُمُ اللّٰهُ بِكُفْرِهِمْ) - elə deyil ki, yəhudilər deyirlər: əksinə, Allah-Təala onların qəlblərini örtüsüz və pərdəsiz yaradıbdır.** (Onlar öz istəkləri ilə kafir olduqlarına görə, Allah-Təala onlara lənət eləyib, öz rəhmətindən kənara salıb, heç vaxt imana daxil olmazlar). **(فَقَلِيلًا مَا يُؤْمِنُونَ) - Tövratın az bir qisminə iman gətirirlər.** (Necə ki daha əvvəl qeyd olundu). **O iman da onlara mənfəət verən deyil. Çünki Allah-Təalanın bəzi ehkamlarını inkar etmək hamısını inkar etmək kimidir.**

**89) (وَلَمَّا جَٓاءَهُمْ) – o zaman ki o yəhudilərə gəldi, (كِتَابٌ مِنْ عِنْدِ اللّٰهِ) - Allah-Təala tərəfindən olan Quran, (مُصَدِّقٌ لِمَا مَعَهُمْ) – o təsdiq edəndir o kitabı** (Tövratı) **ki, onlarda vardır. Belə olan halda, Quranı təkzib edib, qəbul etmədilər. (وَكَانُوا مِنْ قَبْلُ) - halbuki yəhudilər Quran nazil olmadan əvvəl**

يَسْتَفْتِحُونَ عَلَى الَّذِينَ كَفَرُوا فَلَمَّا جَاءَهُمْ مَا عَرَفُوا كَفَرُوا بِهِ فَلَعْنَةُ اللّٰهِ عَلَى الْكَافِرِينَ ﴿٨٩﴾ بِئْسَمَا
اشْتَرَوْا بِهِ اَنْفُسَهُمْ اَنْ يَكْفُرُوا بِمَا اَنْزَلَ اللّٰهُ بَغْيًا اَنْ يُنَزِّلَ اللّٰهُ مِنْ فَضْلِهِ عَلٰى مَنْ يَشَاءُ مِنْ عِبَادِهِ فَبَاؤُ
بِغَضَبٍ عَلٰى غَضَبٍ وَلِلْكَافِرِينَ عَذَابٌ مُهِينٌ ﴿٩٠﴾ وَاِذَا قِيلَ لَهُمْ اٰمِنُوا بِمَا اَنْزَلَ اللّٰهُ قَالُوا نُؤْمِنُ
بِمَا اُنْزِلَ عَلَيْنَا وَيَكْفُرُونَ بِمَا وَرَاءَهُ وَهُوَ الْحَقُّ مُصَدِّقًا لِمَا مَعَهُمْ قُلْ فَلِمَ تَقْتُلُونَ اَنْبِيَاءَ اللّٰهِ مِنْ قَبْلُ

---

**(يَسْتَفْتِحُونَ عَلَى الَّذِينَ كَفَرُوا) – müşriklərlə savaşanda** (bu Məhəmməd peyğəmbərin) vücudu ilə Allah-Təaladan kömək istəyirdilər. Savaşlarda dua edib belə deyirdilər: ilahi, Tövratda vəsflərini tapdığımız o peyğəmbər ki, dünyanın axırında gələcəkdir, onun möhtərəm vücuduna görə, bizə kömək edib, bizi düşmənə qalib et)**. (فَلَمَّا جَاءَهُمْ مَا عَرَفُوا) – Allah-Təala tərəfindən özlərinin də tanıdığı haqq olan peyğəmbər** (Hz. Məhəmməd) **haqq olan kitabıyla** (Quran) **onlara gəldikdə isə (كَفَرُوا بِهِ) - o Quranı və o peyğəmbəri inkar etdilər. (فَلَعْنَةُ اللّٰهِ عَلَى الْكَافِرِينَ) - Allah-Təalanın lənəti kafir olan yəhudilərə olsun ki, Hz. Məhəmmədin və Quranın haqq olduğuna agah olduqları halda kafir olub, onu inkar etdilər.**

**90) (بِئْسَمَا) - nə pis şeydir, o şey ki, (اشْتَرَوْا بِهِ اَنْفُسَهُمْ) - satdılar öz nəfslərini o şeyə,** (hansı ki sizin əvəzinizə aldılar, o, budur:) **(اَنْ يَكْفُرُوا بِمَا اَنْزَلَ اللّٰهُ بَغْيًا) - o Qurana ki, Allah-Təala onu nazil edib. Zülm və həsədlərindən kafir oldular. (اَنْ يُنَزِّلَ اللّٰهُ مِنْ فَضْلِهِ) - həsəd elədilər ona ki, Allah-Təala öz rəhmətindən bir kitab** (Quran) **nazil edib, (عَلٰى مَنْ يَشَاءُ مِنْ عِبَادِهِ) – qullarından Allah-Təalanın özünün istədiyi şəxsə,** (yəni həsəd elədilər ki, nədən ötrü Hz. Məhəmmədə kitab nazil olub?) **(فَبَاؤُ بِغَضَبٍ عَلٰى غَضَبٍ) - yəhudilər bu həsədlərinin səbəbinə qəzəb üstə qəzəbə** (Allah-Təalanın davamlı qəzəbinə) **layiq olub düçar oldular. Hər zaman Allah-Təalanın qəzəbi onlara şamil oldu. (وَلِلْكَافِرِينَ عَذَابٌ مُهِينٌ) - kafir olan yəhudilərdən ötrü qiyamət günündə zəlil və həqir edən əzab hazırdır.**

**91) (وَاِذَا قِيلَ لَهُمْ) – o zaman ki yəhudilərə deyildi** (möminlər yəhudilərə dedilər:) **(اٰمِنُوا بِمَا اَنْزَلَ اللّٰهُ) - iman gətirin Allah-Təalanın nazil elədiyi bu Qurana, (قَالُوا) - yəhudilər dedilər: (نُؤْمِنُ بِمَا اُنْزِلَ عَلَيْنَا) - iman gətirin o kitaba** (Tövrata) **ki, bizə nazil olubdur. (وَيَكْفُرُونَ بِمَا وَرَاءَهُ) - bu sözü deyib Tövratdan başqa kitabı** (Quranı) **inkar etdilər, halbuki (وَهُوَ الْحَقُّ) - Quran Allah-Təaladan haqq olan kitabdır. (مُصَدِّقًا لِمَا مَعَهُمْ) - onlarda olan o kitabı** (Tövratı) **təsdiq edəndir,** (əgər yəhudilər - biz Tövrata iman gətirmişik sözünü doğru deyirlərsə, gərək, Qurana da iman gətirsinlər. Çünki Quran Tövratı təsdiq edəndir)**. (قُلْ)** – (ey Məhəmməd)**, yəhudilərə de: əgər siz Tövrata iman gətiribsinizsə, (فَلِمَ تَقْتُلُونَ اَنْبِيَاءَ اللّٰهِ مِنْ قَبْلُ) - bəs niyə siz** (yəni sizin babalarınız) **Allah-Təalanın bundan əvvəlki peyğəmbərlərini qətlə yetirirsiniz, siz də babalarınızın əməllərinə razı olduğunuzdan onlarla şəriksiniz.**

اِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿٩١﴾ وَلَقَدْ جَآءَكُمْ مُوسٰى بِالْبَيِّنَاتِ ثُمَّ اتَّخَذْتُمُ الْعِجْلَ مِنْ بَعْدِهٖ وَاَنْتُمْ
ظَالِمُونَ﴿٩٢﴾ وَاِذْ اَخَذْنَا مِيثَاقَكُمْ وَرَفَعْنَا فَوْقَكُمُ الطُّورَۜ خُذُوا مَٓا اٰتَيْنَاكُمْ بِقُوَّةٍ وَاسْمَعُواۜ قَالُوا سَمِعْنَا
وَعَصَيْنَا وَاُشْرِبُوا فِي قُلُوبِهِمُ الْعِجْلَ بِكُفْرِهِمْۜ قُلْ بِئْسَمَا يَأْمُرُكُمْ بِهٖٓ اِيمَانُكُمْ اِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿٩٣﴾

---

**(اِنْ كُنْتُمْ مُؤْمِنِينَ) - əgər siz Tövrata iman gətirmiş olsaydınız, babalarınızın peyğəmbərləri qətlə yetirməsinə razı olmazdınız.** (Gələn ayədə yəhudilərin heç vaxt Tövrata iman etmədikləri bəyan edilir)**.**

**92) (وَلَقَدْ جَآءَكُمْ مُوسٰى) - həqiqətən, Musa** (s.ə.s) **siz yəhudilərə Allah-Təala tərəfindən gəldi, (بِالْبَيِّنَاتِ) - aşkar olan möcüzələri ilə. (ثُمَّ اتَّخَذْتُمُ الْعِجْلَ مِنْ بَعْدِهٖ) - Musa Tura gedəndən sonra buzovu özünüzə məbud edib, ona sitayiş etdiniz. Əgər siz Tövrata iman gətiribsinizsə, niyə buzova sitayiş etdiniz? Halbuki Allah-Təala Tövratda şirki qadağan edibdir. (وَاَنْتُمْ ظَالِمُونَ) - halbuki siz elə bir qövmsünüz ki, adətiniz həmişə zülm etməkdir.** (Şirkdən artıq və böyük zülm təsəvvür edilməz. Loğman oğluna nəsihət üçün buyurdu: oğlum, Allah-Təalaya şərik qoşma. Allah-Təalaya şərik qoşmaq böyük zülmdür).

**93) (وَاِذْ اَخَذْنَا مِيثَاقَكُمْ) - yadınıza salın** (ey bəni-İsrail)**, o zaman ki sizdən Musa vasitəsilə möhkəm əhd aldıq ki, gərək Tövrata əməl edəsiniz. (وَرَفَعْنَا فَوْقَكُمُ الطُّورَ)** (Turi-Sinanı onların üstündə ucaltma əhvalatı həmin surədə 63-cü ayənin təfsirində keçdi. Oraya baxılsın). **(خُذُوا مَٓا اٰتَيْنَاكُمْ) - sizə Tövratda nazil elədiyimiz ehkamı dedik ki, onları qəbul edin. (بِقُوَّةٍ) – əlbəttə, gərək, doğruluq və əzmlə əməl edəsiniz. (وَاسْمَعُوا)** – (Tövratda əmr olunduğunuz o hökmləri) **eşidin, (قَالُوا) - dedilər:** (Yəhudilər bizim bu əmrlərimizin cavabında dedilər:) **(سَمِعْنَا) - Tövratın ehkamını eşitdik. (وَعَصَيْنَا) – və eşidəndən sonra o hökmlərə asi olduq.** (Onlar Tövratın ehkamına əməl etməzlər. Necə əməl etsinlər?) **(وَاُشْرِبُوا فِي قُلُوبِهِمُ الْعِجْلَ بِكُفْرِهِمْ) - halbuki Tövratın ehkamını inkar etdikləri üçün buzova ibadət etmək məhəbbəti bəni-İsrailin qəlbinə daxil olub yerləşibdir. (قُلْ)** – (ey Məhəmməd)**, yəhudilərə de: siz ki deyirsiniz, biz Tövrata iman gətirmişik, bəs Tövratın xilafına əməl etməyi Tövrata olan imanınız sizə əmr edir? Əgər belədirsə, (بِئْسَمَا يَأْمُرُكُمْ بِهٖٓ اِيمَانُكُمْ) - o şeyi** (Tövratin xilafına əməl etməyi) **ki, imanınız sizə əmr edir, nə pis şeydir. (اِنْ كُنْتُمْ مُؤْمِنِينَ) - əgər Tövrata iman gətirən olsaydınız, Tövratın xilafına əməl etməzdiniz. Tövratın xilafına əməl etmək Tövrata iman gətirməməyə dəlildir.** (Bu ayədən məqsəd biz Quran əhlini xəbərdar etməkdir. Yəni o şəxslər ki Qurana iman gətirmişik, - deyirlər, onların Qurana xilaf əməl etmələri imansızlıqlarına dəlildir. Amma islam əhlindən heç bir qrup bu mətləbi qəbul edən deyillər. Lakin insafla baxsaq, bugünkü gündə islam ümmətinin bir çox qrupu bu ayənin ehtivasına daxil olubdur. (Yəhudilər

قُلْ اِنْ كَانَتْ لَكُمُ الدَّارُ الْاٰخِرَةُ عِنْدَ اللّٰهِ خَالِصَةً مِنْ دُونِ النَّاسِ فَتَمَنَّوُا الْمَوْتَ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٩٤﴾ وَلَنْ يَتَمَنَّوْهُ اَبَدًا بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ وَاللّٰهُ عَلِيمٌ بِالظَّالِمِينَ ﴿٩٥﴾ وَلَتَجِدَنَّهُمْ اَحْرَصَ النَّاسِ عَلٰى حَيٰوةٍ وَمِنَ الَّذِينَ اَشْرَكُوا يَوَدُّ اَحَدُهُمْ لَوْ يُعَمَّرُ اَلْفَ سَنَةٍ وَمَا هُوَ بِمُزَحْزِحِهِ مِنَ الْعَذَابِ اَنْ يُعَمَّرَ وَاللّٰهُ بَصِيرٌ بِمَا يَعْمَلُونَ ﴿٩٦﴾

---

deyirdilər: cənnətə yəhudidən başqası daxil olmaz, cənnət ancaq bizimdir. Bizdən başqa, heç kim oraya daxil olmaz. Necə ki biz müsəlmanların hər bir qrupu da bu sözü deyir). Allah-Təala sıradakı ayədə onların sözünü və bu sözü qəbul edənləri rədd edir).

**94) (قُلْ)** – (ey Məhəmməd)**, yəhudilərə de ki, (اِنْ كَانَتْ لَكُمُ الدَّارُ الْاٰخِرَةُ) - əgər ancaq sizdən ötrü axirət evi** (cənnət) **varsa, (عِنْدَ اللّٰهِ خَالِصَةً مِنْ دُونِ النَّاسِ) - Allah-Təala yanında sizdən başqa, heç bir şəxs oraya daxil olmayacaqsa, (فَتَمَنَّوُا الْمَوْتَ اِنْ كُنْتُمْ صَادِقِينَ) - əgər bu sözünüzdə doğrusunuzsa, ölməyi arzu edin, ta ki tez ölüb cənnətə daxil olasınız. O şəxs ki, cənnət əhli olduğuna inanır, əlbəttə, ölməyi arzu edər. Hətta ölməyi sağ qalmaqdan daha artıq istəyər.**

**95) (وَلَنْ يَتَمَنَّوْهُ اَبَدًا) - əlbəttə, yəhudilər heç vaxt ölməyi arzu etməzlər. (بِمَا قَدَّمَتْ اَيْدِيهِمْ) - o əməllərə görə ki, onların əlləri o əməlləri qabaqcadan yollayıbdır.** (İnsan əməllərinin əksərini əlləri ilə etdiyindən Allah-Təala ənənəyə əsasən, yəhudilərin əməllərini onların əllərinə isnad etdi)**. (وَاللّٰهُ عَلِيمٌ بِالظَّالِمِينَ) - Allah-Təala zalım olan yəhudilərdən və onların etdiyi əməllərdən agahdır. Onların əməllərinin cəzasını onlara verəcəkdir.**

**96) (وَلَتَجِدَنَّهُمْ) - əlbəttə, o yəhudiləri görərsən, (اَحْرَصَ النَّاسِ) – insanların ən hərisi** (olduğunu)**, (عَلٰى حَيٰوةٍ) – uzun həyata, (وَمِنَ الَّذِينَ اَشْرَكُوا) - və yəhudilərin dünya həyatına müşriklərdən həris olduğunu görərsən, halbuki əhli-kitab gərək müşriklər kimi olmayıb, axirətə inansınlar. Amma yəhudilərin Tövrata iman gətirmələri zahirdə olduğundan axirətə etiqadları olmayıb, müşriklərdən daha çox dünyaya hərisdirlər.** (Buna görə də, ölməyi necə arzu etsinlər) **(يَوَدُّ اَحَدُهُمْ) - onların hər biri istəyər, (لَوْ يُعَمَّرُ اَلْفَ سَنَةٍ) - kaş min il dünyada ömür sürəydi, (وَمَا هُوَ بِمُزَحْزِحِهِ مِنَ الْعَذَابِ اَنْ يُعَمَّرَ) - dünyada uzun ömür sürmək Allah-Təalanın əzabından onu qoruya bilməz. (وَاللّٰهُ بَصِيرٌ بِمَا يَعْمَلُونَ) - Allah-Təala onların hər bir əməllərindən agahdır və onu görəndir.** (Fədək yəhudilərinin üləmasından Abdullah ibn Suriya uca peyğəmbərimizlə mübahisə edib sual verdi: "Ey Məhəmməd, sənə hansı mələk nazil olub vəhy göndərir? Peyğəmbər buyurdu: Cəbrayıl (Ruhül-müqəddəs, ruhani qüvvə). Abdullah dedi: o, bizim düşmənimizdir. Əgər vəhyi gətirən başqa bir mələk olsaydı, o vaxt biz sənə iman gətirərdik. Ayə Abdullahın bu sözünü rədd etmək üçün nazil oldu).

قُلْ مَنْ كَانَ عَدُوًّا لِجِبْرِيلَ فَاِنَّهُ نَزَّلَهُ عَلٰى قَلْبِكَ بِاِذْنِ اللّٰهِ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ وَهُدًى وَبُشْرٰى
لِلْمُؤْمِنِينَ ﴿٩٧﴾ مَنْ كَانَ عَدُوًّا لِلّٰهِ وَمَلٰٓئِكَتِهِ وَرُسُلِهِ وَجِبْرِيلَ وَمِيكَالَ فَاِنَّ اللّٰهَ عَدُوٌّ لِلْكَافِرِينَ
﴿٩٨﴾ وَلَقَدْ اَنْزَلْنَآ اِلَيْكَ اٰيَاتٍ بَيِّنَاتٍۚ وَمَا يَكْفُرُ بِهَآ اِلَّا الْفَاسِقُونَ ﴿٩٩﴾ اَوَكُلَّمَا عَاهَدُوا عَهْدًا نَبَذَهُ
فَرِيقٌ مِنْهُمْۜ بَلْ اَكْثَرُهُمْ لَا يُؤْمِنُونَ ﴿١٠٠﴾ وَلَمَّا جَآءَهُمْ رَسُولٌ مِنْ عِنْدِ اللّٰهِ مُصَدِّقٌ لِمَا مَعَهُمْ

---

**97) (قُلْ) -** (ey Məhəmməd)**, Abdullah ibn Suriyaya de: (مَنْ كَانَ عَدُوًّا لِجِبْرِيلَ) - kim ki** (sənə kitab nazil etdiyi üçün) **Cəbrayıla düşmən olsa,** (bilsin ki, gərək onu sevib, şükür etsinlər. Ona düşmənçilik etmək çirkin və zidd bir əməldir. Çünki Cəbrayıl o kitabı sənə özündən gətirməyibdir)**. (فَاِنَّهُ نَزَّلَهُ عَلٰى قَلْبِكَ بِاِذْنِ اللّٰهِ) - həqiqətən, Cəbrayıl Allah-Təalanın izni ilə Quranı sənin qəlbinə nazil edibdir, öz yanından nazil etməyib.** (Cəbrayılı düşmən sayan, həqiqətdə, Allah-Təalanı düşmən sayar. Qurani-Şərifin ayələri peyğəmbərin mübarək qəlbinə vəhy olunur, oradan dilinə keçib, xalqa elan edilirdi)**. (مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ) - Quran özündən əvvəlki kitabları (Tövratı, İncili) təsdiq edən bir halda** (Cəbrayıl onu nazil edibdir. Tövrata müxalif deyil ki, Abdullah Cəbrayılı düşmən saysın)**. (وَهُدًى وَبُشْرٰى لِلْمُؤْمِنِينَ) - Quran möminləri haqq yoluna hidayət edib, nicat tapacaqlarını müjdə verir.** (Gələn ayə də bəyan edir ki, Cəbrayılı düşmən sayan şəxs Allah-Təalaya, onun mələklərinə və peyğəmbərlərinə düşmən sayılar. Belə şəxs kafirdir)**.**

**98) (مَنْ كَانَ عَدُوًّا لِلّٰهِ) – kim ki düşmən olsa, Allah-Təalaya, (وَمَلٰٓئِكَتِهِ)- və Onun mələklərinə, (وَرُسُلِهِ وَجِبْرِيلَ وَمِيكَالَ) Onun peyğəmbərlərinə, Cəbrayıla və Mikayıla, (فَاِنَّ اللّٰهَ عَدُوٌّ لِلْكَافِرِينَ) - həqiqətən, Allah-Təala belə kafir şəxslərə** (yəhudilərə və yəhudilərin sözünü qəbul edənlərə) **düşməndir.**

**99) (وَلَقَدْ اَنْزَلْنَآ اِلَيْكَ اٰيَاتٍ بَيِّنَاتٍ) -** (ey Məhəmməd)**, həqiqətən, doğruluğu aşkar olan ayələri sənə nazil etdik. (وَمَا يَكْفُرُ بِهَآ اِلَّا الْفَاسِقُونَ) - o ayələri fasiqlərdən** (küfr və inadlarında həddi aşanlardan, o cümlədən yəhudilərdən) **başqası inkar etməz.**

**100) (اَوَكُلَّمَا عَاهَدُوا عَهْدًا) - yəhudilər hər dəfə söz verəndən sonra Quran ayələrini inkar etmədilərmi? (نَبَذَهُ فَرِيقٌ مِنْهُمْ) - yəhudilərdən bir qrup** (verdikləri) **o sözü inkar edib ona əməl etmədilər. Əgər sözlərinə əməl etsəydilər, Quran Tövratı təsdiq etdiyi üçün, gərək, Qurana da iman gətirəydilər. Əgər Tövrata iman gətirsəydilər, Qurani-Şərifin ayələrini inkar etməzdilər.** (بَلْ اَكْثَرُهُمْ لَا يُؤْمِنُونَ) **Bəlkə yəhudilərin əksəriyyəti Tövrata iman gətirməyiblər. Əgər onlar iman gətirsəydilər Qurani-Kərim ayələrini inkar etməzdilər.**

**101) (وَلَمَّا جَآءَهُمْ رَسُولٌ مِنْ عِنْدِ اللّٰهِ) - O zaman ki Allah-Təala tərəfindən yəhudilərə bir peyğəmbər (Hz. Məhəmməd ə.s) gəldi, (مُصَدِّقٌ لِمَا مَعَهُمْ) –**

نَبَذَ فَرِيقٌ مِنَ الَّذِينَ اُوتُوا الْكِتَابَ ۙ كِتَابَ اللّٰهِ وَرَآءَ ظُهُورِهِمْ كَاَنَّهُمْ لَا يَعْلَمُونَ﴿١٠١﴾ وَاتَّبَعُوا مَا
تَتْلُوا الشَّيَاطِينُ عَلٰى مُلْكِ سُلَيْمٰنَ ۚ وَمَا كَفَرَ سُلَيْمٰنُ وَلٰكِنَّ الشَّيَاطِينَ كَفَرُوا يُعَلِّمُونَ النَّاسَ السِّحْرَ
ۗ وَمَٓا اُنْزِلَ عَلَى الْمَلَكَيْنِ بِبَابِلَ هَارُوتَ وَمَارُوتَ ۜ

---

**hansı ki** (Hz. Məhəmməd) **və Quran yəhudilərin kitabını** (Tövratı) **təsdiq edəndir, (**نَبَذَ فَرِيقٌ مِنَ الَّذِينَ اُوتُوا الْكِتَابَ ۙ كِتَابَ اللّٰهِ**) - bu peyğəmbər Tövratı təsdiq etdiyi üçün gərək yəhudilər ona iman gətirəydilər, çünki Tövratda bu peyğəmbərin gəlməsi və Tövratı təsdiq etməsi xəbər verilibdir. Amma Tövrat əhlindən bir qrup Allah-Təalanın kitabını** (Tövratı) **tərk edib tulladılar, (**وَرَآءَ ظُهُورِهِمْ**) - arxa tərəflərinə,** (bu, yəhudilərin Tövrata əməl etməməsinə kinayədir, yəhudilərin Tövrata əməl etməməsinin nümunəsi budur ki, Tövratdan üz döndərib, əsla ona baxmırlar. Yəni əgər ona əməl etsəydilər, gərək, Hz. Məhəmmədin peyğəmbərliyini təsdiq edəydilər). **(**كَاَنَّهُمْ لَا يَعْلَمُونَ**) - sanki, yəhudilər agah deyildilər ki, Tövrat Allah-Təalanın kitabı olub, ona əməl edilməlidir.** (Əlbəttə, agah idilər, Tövrat Allah-Təalanın kitabıdır, amma Hz. Məhəmmədi inkar Tövratı inkardır onu Allah-Təalanın kitabı hesab etməmək kimidir). **Hz. Süleymanın (ə.s) zamanında sehrbazlar yaşayıb, sehr elmini kitablarda toplamışdılar. Onlardan başqa, Babildə sehr elmində son dərəcə kamil olan iki padşahdan sehr elmini öyrənib, kitablarda toplayıb yazmışdılar. Yəhudilərin əksəriyyəti bu qeyd olunan sehr kitablarına etiqad edirdilər. Tövratı tərk edib bu sehr kitabları ilə əməl edirdilər.** (Necə ki bizim müsəlmanların əksəriyyəti Quranı tərk edib, uydurma xəbərlərə, dua və tilsim kitablarına etiqad göstərib əməl edirlər). Allah-Təala sıradakı ayədə yəhudiləri məzəmmət edib, sehr elminin batil olmasını və onda heç bir təsir olmayıb, olsa da, Allah-Təalanın izni ilə olduğunu bəyan edir).

**102) (**وَاتَّبَعُوا**) - yəhudilər Tövratı tərk edib tabe oldular, (**مَا تَتْلُوا الشَّيَاطِينُ**) - o sehr kitablarına ki, o kitabları sehrbazlar oxuyurdular,** (şeytanlardan məqsəd sehrbazlardır. Şeytan - itaətdən çıxmaq mənasındadır. Ərəblər azğın ata şeytan deyirlər)**. (**عَلٰى مُلْكِ سُلَيْمٰنَ**) - sehrbazlar o kitabları Hz. Süleymanın səltənəti dövründə oxuyurdular, (**وَمَا كَفَرَ سُلَيْمٰنُ**) - Süleyman sehr kitablarına tabe olmadı, kafir olmadı.** (Halbuki yəhudilər deyirdilər ki, Süleymanın səltənəti sehr elmi ilə güclənibdir). **(**وَلٰكِنَّ الشَّيَاطِينَ كَفَرُوا**) - lakin sehrbazlar sehr kitablarına tabe olub kafir oldular. (**يُعَلِّمُونَ النَّاسَ السِّحْرَ**) - özlərində olan sehr elmini xalqa öyrədirdilər. *(**وَمَٓا اُنْزِلَ عَلَى الْمَلَكَيْنِ بِبَابِلَ**) - bir də Babildə iki padşaha (**هَارُوتَ وَمَارُوتَ**) nazil olan sehr elmini də xalqa öyrədirdilər.**

*(***Qeyd:** (və ma unzilə aləl-məlikeyn)- İki şəkildə oxunubdur. Birincisi odur ki, qeyd olundu. "Məlikeyn", yəni lam hərfini kəsrə (i səsi) ilə oxuyanda məqsəd iki padşahdır. O biri qiraət tərzi "mələkeyn"dir. Yəni lamı fəthə (ə səsi) ilə oxuyanda mənası iki nəfər mələk deməkdir. Bu qiraət tərzi məşhurdur. Amma bu zaman böyük qüsur*

وَمَا يُعَلِّمَانِ مِنْ اَحَدٍ حَتّٰى يَقُولَا اِنَّمَا نَحْنُ فِتْنَةٌ فَلَا تَكْفُرْ فَيَتَعَلَّمُونَ مِنْهُمَا مَا يُفَرِّقُونَ بِهٖ بَيْنَ الْمَرْءِ وَزَوْجِهٖ وَمَا هُمْ بِضَٓارّ۪ينَ بِهٖ مِنْ اَحَدٍ اِلَّا بِاِذْنِ اللّٰهِ وَيَتَعَلَّمُونَ مَا يَضُرُّهُمْ وَلَا يَنْفَعُهُمْ وَلَقَدْ عَلِمُوا لَمَنِ اشْتَرٰيهُ مَا لَهُ ف۪ي الْاٰخِرَةِ مِنْ خَلَاقٍ وَلَبِئْسَ مَا شَرَوْا بِهٖٓ اَنْفُسَهُمْ لَوْ كَانُوا يَعْلَمُونَ ﴿١٠٢﴾
وَلَوْ اَنَّهُمْ اٰمَنُوا وَاتَّقَوْا لَمَثُوبَةٌ مِنْ عِنْدِ اللّٰهِ خَيْرٌ لَوْ كَانُوا يَعْلَمُونَ ﴿١٠٣﴾

---

*yaranıb, mətləbi izah etmək müşkül olur. Bunlar Babildə xalqa sehr öyrədirdilər. O səbəbdən mən həqir ilk qiraət tərzi əsasında ayəyə məna verdim. Çox məşhur olan şey vardır ki, onun əsli yoxdur).*

**Onların birinin adı Harut, o birinin adı Marut idi** (amma o padşahlar kafir deyildi)**.** (وَمَا يُعَلِّمَانِ مِنْ اَحَدٍ) **- o padşahlar sehr elmini heç bir şəxsə öyrətmirdilər, ancaq bir şərtlə** (öyrədirdilər), (حَتّٰى يَقُولَا) **- ancaq** (öyrədəndə) **deyirdilər ki,** (اِنَّمَا نَحْنُ فِتْنَةٌ) **- həqiqətən, biz bu sehr elmini fitnə və imtahan üçün xalqa öyrədirik.** (Görək xalq sehr elmini öyrənəndən sonra Allah-Təalanı inkar edir, yoxsa yox?). (فَلَا تَكْفُرْ) **- sən bizdən sehr elmini öyrənirsən, Allah-Təalanı inkar etmə. O padşahlar xalqa sehr elmini öyrədib belə deyirdilər.** (فَيَتَعَلَّمُونَ مِنْهُمَا مَا يُفَرِّقُونَ بِهٖ) **- xalq o iki padşahdan o sehr elmini öyrənirdi ki, hansı ki ayrılıq salırdı,** (بَيْنَ الْمَرْءِ وَزَوْجِهٖ) **- kişiylə qadının arasına.** (Sehr elmində təsir olmaz və olsa da, Allah-Təalanın izni ilə olar. Bundan sonra bəyan edir:) (وَمَا هُمْ بِضَٓارّ۪ينَ بِهٖ مِنْ اَحَدٍ) **-yəhudilər şüursuz olduqlarından onlara zərər verib mənfəət verməyən elmi** (sehr elmini) **öyrənirdilər.** (Sehr elmini xalqa zərər vermək üçün öyrənən şəxslərdən ötrü Allah-Təala yanında böyük əzab vardır). (وَلَقَدْ عَلِمُوا لَمَنِ اشْتَرٰيهُ) **- həqiqətən, yəhudilər buna agah oldular ki, kim ki sehr elmini Allah-Təalanın kitabının əvəzinə seçir,** (مَا لَهُ ف۪ي الْاٰخِرَةِ مِنْ خَلَاقٍ) **– o şəxsdən ötrü axirətdə axirət nemətlərindən heç bir hissə və nəsibi yoxdur. Bundan sonra yenə sehr elmini Tövratdan üstün saydılar.** (وَلَبِئْسَ مَا شَرَوْا بِهٖٓ اَنْفُسَهُمْ) **– qarşılığında özlərini satdıqları şey nə pis şeydir, sehr elmini Tövrata üstün tutub, əvəzində özlərinə əzabı seçdilər.** (لَوْ كَانُوا يَعْلَمُونَ) **– kaş bu alıb satmağın zərərinə agah olub bunu tərk edəydilər.** (halbuki buna agah idilər, amma elmləri ilə əməl etməmək səbəbinə Allah-Təala onların cahil olduğunu buyurur. Elmi ilə əməl etməyən alim cahilə bərabər, hətta ondan da əskikdir. Biz müsəlmanlar Qurani-Şərifi tərk edib, yalan sözləri və uydurma xəbərləri Quranın əvəzində qəbul etdiyimiz üçün bizimlə Tövrat əhli arasında heç bir fərq yoxdur).

**103)** (وَلَوْ اَنَّهُمْ اٰمَنُوا) **- əgər o yəhudilər Qurana iman gətirsəydilər,** (وَاتَّقَوْا) **- Allah-Təaladan qorxub, Tövratı atıb sehrə tabe olmasaydılar,** (لَمَثُوبَةٌ مِنْ عِنْدِ اللّٰهِ خَيْرٌ) **- əlbəttə, az olan əcr, savab Allah-Təala yanında onlardan ötrü Allah-Təalanı inkar etməkdən yaxşı idi.** (لَوْ كَانُوا يَعْلَمُونَ) **- kaş yəhudilər küfr və zəlalətlərindənsə Allah-Təalanın əcr və savabının yaxşı olmasına**

يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا لَا تَقُولُوا رَاعِنَا وَقُولُوا انْظُرْنَا وَاسْمَعُواۜ وَلِلْكَافِرٖينَ عَذَابٌ اَلٖيمٌ ﴿١٠٤﴾ مَا
يَوَدُّ الَّذٖينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ وَلَا الْمُشْرِكٖينَ اَنْ يُنَزَّلَ عَلَيْكُمْ مِنْ خَيْرٍ مِنْ رَبِّكُمْۜ وَاللّٰهُ يَخْتَصُّ
بِرَحْمَتِهٖ مَنْ يَشَآءُۜ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظٖيمِ﴿١٠٥﴾

---

**agah olaydılar. O vaxt da küfr və zəlaləti tərk edib Allah-Təalanın savabına tabe olardılar.** (Halbuki agah idilər, lakin elmləri ilə əməl etmədikləri üçün cahil olaraq göstərildilər)**. Hər dəfə Hz. Peyğəmbər (ə.s) Allah-Təala tərəfindən möminlərə ehkamı bildirəndə möminlər belə deyərdilər:** (raina ya rəsulullah) **- yəni bizi gözlə, möhlət ver bizə, ta ki ilahi hökmü anlayıb yadda saxlayaq. "Raina" kəlməsi yəhudi dilində isə "bizim çoban" mənasında idi. Belə məqamda yəhudilər fürsətdən istifadə edib, peyğəmbərlə hər dəfə danışanda qəsdən "raina" deyib sataşardılar. Hz. Peyğəmbərin səhabələrindən olan Sə`d ibn Muaz bu kəlməni yəhudilərdən eşidib** (onların bəzi sözlərinə agah idi)**, onların məqsədini anladı. Dedi: "Ey yəhudi camaatı, əgər bir dəfə də bu kəlməni sizdən eşitsəm, tamamən sizi qətlə yetirərəm. Yəhudilər Sə`d ibn Muazın qorxusundan sakit oldular. Sə`d ibn Muaz ənsardan Evs tayfasının rəisi olub, islama çox kömək edib, son dərəcə qeyrətli şəxslərdən biri idi** (Allah ondan razı olub, rəhmət etsin!)**. Buna görə növbəti ayədə möminlərə o kəlməni demək qadağan edilib, onun əvəzinə başqa bir kəlməni deməklə əmr olundular. Necə ki buyurur:**

**104) (يَآ اَيُّهَا الَّذٖينَ اٰمَنُوا) - ey iman gətirən şəxslər, (لَا تَقُولُوا رَاعِنَا) – peyğəmbərlə danışanda "raina" kəlməsini deməyin. Elə deyəndə yəhudilər də sizə tabe olub bu kəlməni deyirlər. Amma əsl məqsədləri peyğəmbəri söyməkdir. (وَقُولُوا انْظُرْنَا) - o kəlmənin əvəzində "unzurnə" (yəni, möhlət ver bizə) kəlməsini deyin. (وَاسْمَعُوا) – peyğəmbərin sözlərini yaxşı eşidib, yadda saxlayın ki, yenidən soruşub, möhlət istəməyə ehtiyacınız olmasın. (وَلِلْكَافِرٖينَ عَذَابٌ اَلٖيمٌ) - kafir olan yəhudilərdən ötrü** (hansı ki peyğəmbərə söyüş söyübdür) **axirətdə böyük şiddətli əzab vardır.**

**105) (مَا يَوَدُّ الَّذٖينَ كَفَرُوا مِنْ اَهْلِ الْكِتَابِ وَلَا الْمُشْرِكٖينَ) - kafir olan yəhudilər və müşriklər istəməzlər ki, (اَنْ يُنَزَّلَ عَلَيْكُمْ مِنْ خَيْرٍ مِنْ رَبِّكُمْ) - siz möminlərin rəbbi Allah-Təaladan sizə bir vəhy nazil olub, bir hökm, ya da bir kitab göndərsin. (وَاللّٰهُ يَخْتَصُّ بِرَحْمَتِهٖ مَنْ يَشَآءُ) - halbuki Allah-Təala peyğəmbərlikdən ötrü istədiyi şəxsi seçər.** (Peyğəmbərlik yəhudilərin, ya da müşriklərin istəyi ilə deyildir). **(وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظٖيمِ) - Allah-Təala böyük ehsan və rəhmət sahibidir. Peyğəmbərlik üçün kimi seçirsə, o şəxs özü bunu qazanmayıb, bu, Allah-Təalanın ona olan lütfüdür.** ("Nəsx" - bir hökmü tərk edib, onun əvəzində başqa bir hökmü sabit etmək mənasındadır. Quranda və hədisdə bu mənadakı nəsx islam ümmətinin icması ilə sabitdir, sıradakı ayənin özü nəsxə

مَا نَنْسَخْ مِنْ اٰيَةٍ اَوْ نُنْسِهَا نَاْتِ بِخَيْرٍ مِنْهَٓا اَوْ مِثْلِهَاۜ اَلَمْ تَعْلَمْ اَنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ ﴿١٠٦﴾
اَلَمْ تَعْلَمْ اَنَّ اللّٰهَ لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَمَا لَكُمْ مِنْ دُونِ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَص۪يرٍ ﴿١٠٧﴾ اَمْ
تُر۪يدُونَ اَنْ تَسْـَٔلُوا رَسُولَكُمْ كَمَا سُئِلَ مُوسٰى مِنْ قَبْلُۜ

---

bir dəlildir. Bu mənadakı nəsx ağıl və hikmətə müvafiqdir, çünki şəriət ehkamı xalqa gərək tədricən öyrədilsin. Məsul olan şəxslər bu məsuliyyət yükünün altına gərək hikmət üzrə daxil olsunlar. Bununla birlikdə, peyğəmbər gəldiyi zaman öncə gərək xalqdan ötrü asan hökmlər vəz etsin. Ondan sonra əgər məsləhət olsa, o hökmlərin bəzisini dəyişdirib, əvəzində daha uyğun hökmlər verər. Necə ki peyğəmbərimiz əvvəlcə Allah-Təalanın əmri ilə müsəlmanlara hər ayda üç gün oruc tutmalarını əmr etmişdi. Sonra o hökm dəyişdirildi, əvəzində Allah-Təala Qurani-Şərifdə müsəlmanların Ramazan ayında oruc tutmasını əmr etdi. Bu mənadakı nəsxdə heç bir eyib və nöqsan yoxdur. Amma yəhudilər inadkar və cahil bir qövm olduğundan, peyğəmbərin bu hərəkətinə (nəsxə) irad tutdular. Allah-Təala yəhudilərin iddiasını rədd etmək üçün sıradakı ayəni nazil buyurdu).

**106) (مَا نَنْسَخْ مِنْ اٰيَةٍ) – bir ayəni və bir hökmü nəsx etmərik** (hansı ki onun hökmü götürülüb, amma qiraəti qalsın), **(اَوْ نُنْسِهَا) - və ya bir ayənin götürülməsi və xalqın qəlbindən unutdurulması üçün hökm etmərik,** (hansı ki o ayə əsla qiraət olunmasın), **(نَاْتِ بِخَيْرٍ مِنْهَٓا) – ancaq o zaman** (edərik) **ki, hikməti ondan artıq olan yaxşı bir ayə gətirərik. (اَلَمْ تَعْلَمْ)** – (ey nəsxi inkar edən), **bəs agah deyilsən ki, (اَنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ) - həqiqətən, Allah-Təala hər bir şeyə qadirdir,** (bir hökmü götürüb onun yerinə başqa bir hökm vermək) **Allah-Təala üçün asandır. Onda heç bir nöqsan yoxdur).**

**107) (اَلَمْ تَعْلَمْ)** – (ey nəsxi inkar edən), **bəs agah deyilsən ki, (اَنَّ اللّٰهَ لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ) - həqiqətən, səmaların və yerin səltənəti Allah-Təalaya məxsusdur. İstədiyi kimi onlarda hökm edib, hər bir zamanın hikmətinə görə xalqın arasında hökm verər). (وَمَا لَكُمْ مِنْ دُونِ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَص۪يرٍ) - Allah-Təaladan başqa, nə bir dostunuz** (hakiminiz), **nə də bir köməkçiniz yoxdur.** (Sizin bütün işlərinizin tədbiri Allah-Təalaya məxsusdur), hikmət üzrə aranızda hökm verər. Məsləhət üzrə bəzi ehkamları nəsx edib, onun əvəzinə başqa bir hökm verər. Lakin siz ehkamın və nəsxin hikmətlərinə agah olmayıb, irad tutursunuz).

**108) (اَمْ تُر۪يدُونَ)** – (ey yəhudi camaatı), **istəyirsiniz ki, (اَنْ تَسْـَٔلُوا رَسُولَكُمْ) - peyğəmbərinizdən** (Hz. Məhəmmədən ə.s) **küfrə bais olan sözləri soruşasınız? (كَمَا سُئِلَ مُوسٰى مِنْ قَبْلُ) - necə ki bundan əvvəl sizin babalarınız Hz. Musadan soruşmuşdular. Yəni o suallar ki, siz yəhudilərin ata-babaları Musadan (ə.s) soruşub belə demişdilər: "Bizdən ötrü bir büt düzəlt. Allah-Təalanı aşkar görmədikcə sənə iman gətirmərik"). Siz də istəyirsiniz**

وَمَنْ يَتَبَدَّلِ الْكُفْرَ بِالْاِيمَانِ فَقَدْ ضَلَّ سَوَآءَ السَّبِيلِ ﴿١٠٨﴾ وَدَّ كَثِيرٌ مِنْ اَهْلِ الْكِتَابِ لَوْ يَرُدُّونَكُمْ مِنْ بَعْدِ اِيمَانِكُمْ كُفَّارًاۚ حَسَدًا مِنْ عِنْدِ اَنْفُسِهِمْ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْحَقُّۚ فَاعْفُوا وَاصْفَحُوا حَتّٰى يَاْتِيَ اللّٰهُ بِاَمْرِهٖۜ اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ﴿١٠٩﴾

---

**ata-babalarınız kimi bu peyğəmbərə sual verəsiniz, bu sualları tərk edin.** (Yəhudi camaatı öz aralarında danışdı ki, peyğəmbərə bu sualları versinlər. Peyğəmbər Allah-Təala tərəfindən onların batinlərini onlara xəbər verdi. Bu, Hz. Peyğəmbərimizdən ötrü bir möcüzədir). **(وَمَنْ يَتَبَدَّلِ الْكُفْرَ بِالْاِيمَانِ) - kim ki imanı küfrlə dəyişər, Allah-Təalanın ayələrinə şəkk edib küfrə bais olan sözləri soruşar, (فَقَدْ ضَلَّ سَوَآءَ السَّبِيلِ) - həqiqətən, o şəxs xəta edib, asi olub hidayət yolundan çıxıbdır.** (Fənhas ibn Azurə, Zeyd ibn Qeys və başqa bir neçə nəfər yəhudi Uhud savaşından sonra peyğəmbərin səhabələrindən olan Xuzeyfə ibnül-Yamanla və Əmmar ibn Yasirlə qarşılaşanda dedilər: bəs görmədiniz ki, savaşda sizə nə oldu? (Uhud savaşı peyğəmbər ilə Məkkə əhli arasında hicrətin 3-cü ilində vaqe olub, o savaşda peyğəmbərin qoşunu məğlub oldu). Əgər siz haqq olsaydınız, məğlub olmazdınız. Siz gəlib bizim dinimizə daxil olun, o sizdən ötrü daha yaxşıdır və bizim dinimiz sizin dininizdən yaxşıdır. Əmmar dedi: "Ey yəhudi camaatı, sizdə əhdi pozmaq necədir?" Dedilər: "Çox pis şeydir". Əmmar dedi: "Mən söz vermişəm, nə qədər ki, dünyada yaşayıram, gərək Hz. Məhəmmədi inkar etməyim". Yəhudilər dedilər: "Əmmar dindən çıxıb, daha dinə qayıdan deyil". Xuzeyfə dedi: "Mən də Allah-Təalanı məbud, Hz. Məhəmmədi peyğəmbər, islamı din, Quranı imam və rəhbər, Kəbəni qiblə, möminləri qardaş bilib, onlardan razı olmuşam". Yəhudilər sakit oldular. Xuzeyfə və Əmmar peyğəmbərin hüzuruna gəlib bu hadisəni nəql etdilər. Peyğəmbər buyurdu: "Xeyrə yetişib nicat tapdınız". O vaxt bu ayə nazil oldu).

**109) (وَدَّ كَثِيرٌ مِنْ اَهْلِ الْكِتَابِ) – əhli-kitabdan çox adam istədi ki,** (necə ki qeyd olundu), **(لَوْ يَرُدُّونَكُمْ) - kaş qaytaraydılar siz möminləri, (مِنْ بَعْدِ اِيمَانِكُمْ كُفَّارًا) – Hz. Məhəmmədə iman gətirəndən sonra küfr tərəfinə, hamınız kafir olaydınız, (حَسَدًا) - həsədlərindən bu arzunu etdilər, (yəni sizin islama daxil olub, islamın günbəgün tərəqqi etməsinə həsəd etdilər). (مِنْ عِنْدِ اَنْفُسِهِمْ)** – (bu həsəd) **onların özlərindən** (şəri əmr edən xəbis nəfsi-əmmarələrindən) **meydana gəldi. (مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمُ الْحَقُّ) - siz möminlərin haqq olmanız onlara aşkar olandan sonra sizə həsəd edib, kafir olmağınızı arzu etdilər. (فَاعْفُوا وَاصْفَحُوا) – hərçənd yəhudilər siz möminlərə pislik ediblər, amma siz onları əfv edib bağışlayın. (حَتّٰى يَاْتِيَ اللّٰهُ بِاَمْرِهٖ) – ta ki Allah-Təala yəhudilər barəsində öz əmrini göstərsin. (Bir müddət sonra Allah-Təalanın əmri gəlib, yəhudi camaatı müsəlmanların əlində zəlil oldu. Bəni-Qüreyzə camaatını qətlə yetirib, bəni-Nadiri yurdlarından qovdular. ( اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) – həqiqətən, Allah-Təala hər bir şeyə qadirdir.**

وَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَۜ وَمَا تُقَدِّمُوا لِاَنْفُسِكُمْ مِنْ خَيْرٍ تَجِدُوهُ عِنْدَ اللّٰهِۜ اِنَّ اللّٰهَ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿١١٠﴾ وَقَالُوا لَنْ يَدْخُلَ الْجَنَّةَ اِلَّا مَنْ كَانَ هُودًا اَوْ نَصَارٰىۜ تِلْكَ اَمَانِيُّهُمْۜ قُلْ هَاتُوا بُرْهَانَكُمْ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿١١١﴾ بَلٰى مَنْ اَسْلَمَ وَجْهَهُ لِلّٰهِ وَهُوَ مُحْسِنٌ فَلَهُ اَجْرُهُ عِنْدَ رَبِّهٖۖ وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ۟ ﴿١١٢﴾

---

**110) (**وَأَقِيمُواْ الصَّلاَةَ وَآتُواْ الزَّكَاةَ**) Ey möminlər! Siz ki, yəhudiləri bağışlamaqla əmrolundunuz namazı həmişə qılın, zəkatı verib bu iki böyük ibadəti qoruyun. (**وَمَا تُقَدِّمُواْ لأَنفُسِكُم مِّنْ خَيْرٍ**) Həyatda ikən öz nəfslərinizdən ötrü işlədiyiniz hər bir xeyir əməli (**تَجِدُوهُ عِندَ اللّهِ**) O xeyir əməlinizi Allah qatında tapacaqsınız. (**إِنَّ اللّهَ بِمَا تَعْمَلُونَ بَصِيرٌ**) Həqiqətdə Allah sizin əməllərinizi görüb biləndir.**

**111) (**وَقَالُوا**) -** (əhli-kitab - yəhudi və xristianlar) **dedilər: (**لَنْ يَدْخُلَ الْجَنَّةَ اِلَّا مَنْ كَانَ هُودًا اَوْ نَصَارٰى**) - yəhudilər dedilər: "Yəhudilərdən başqası cənnətə daxil olmaz". Xristianlar dedilər: "Xristianlardan başqası cənnətə daxil olmaz".** (Hz. Musanın ümmətinə yəhudi, Hz. İsanın ümmətinə xristian deyilir)**. (**تِلْكَ اَمَانِيُّهُمْ**) - yəhudi və xristianların bu sözləri onların öz arzularıdır. (**قُلْ**)** – (ey Məhəmməd)**, əhli-kitaba de ki, (**هَاتُوا بُرْهَانَكُمْ اِنْ كُنْتُمْ صَادِقِينَ**) – o söz ki, deyirsiniz: "Bizdən başqa, heç kim cənnətə daxil olmaz, əgər bu iddianızda doğrusunuzsa, dəlilinizi gətirin, çünki dəlili olmayan söz qəbul olunmaz".** (Bu ayə təqlidçi müsəlmanların da bənzər sözlərini batil edir)**.**

**112) (**بَلٰى**) - yəhudi və xristianların iddiası batildir. Cənnət ancaq onlara məxsus olmayıb, onlardan başqası da cənnətə daxil olar.** (Bu ayə yəhudi və xristianlar kimi bənzər iddia irəli sürənlərin iddiasını da batil edir)**. (**مَنْ اَسْلَمَ وَجْهَهُ لِلّٰهِ**) - kim ki özünü Allah-Təalaya məxsus edib, Ona şərik qoşmasa, (**وَهُوَ مُحْسِنٌ**) - müvəhhid olub, xeyir əməl etsə, (**فَلَهُ اَجْرُهُ عِنْدَ رَبِّهٖ**) - o şəxsdən ötrü öz rəbbi Allah-Təala yanında əcr və savab vardır. (**وَلَا خَوْفٌ عَلَيْهِمْ**) - onlara qiyamət gününün əzabından qorxu yoxdur. (**وَلَا هُمْ يَحْزَنُونَ**) - məhzun və qəmgin olmazlar.** (Hz. Məhəmməd Mədinədə olanda Nəcran* xristianları qarşılıqlı bədduadan (mübahələ) ötrü peyğəmbərin hüzuruna** gəldilər, bu hadisə inşallah bundan sonra gələn 3-cü surənin 57-ci ayəsində qeyd olunacaqdır. O vaxt yəhudilərin üləmaları ilə xristianlar arasında mübahisə oldu. Səs-küyləri artdı. Yəhudilər Hz. İsaya inanmadıqları üçün xristianlara dedilər: "Sizin dininiz bir şey deyil, biz İsanı və İncili inkar etdik". Halbuki xristianlar Hz. İsanın fərmanı ilə gərək Musanı təsdiq edib, Tövrata əməl etsinlər. Amma cəhalət və inadkarlıqlarından yəhudilər kimi kafir oldular. O vaxt da bu ayə nazil oldu).

*(*****Qeyd:** Nəcran bir yerin adıdır, Ərəbistanda oranın əhalisi xristian idi).*

وَقَالَتِ الْيَهُودُ لَيْسَتِ النَّصَارٰى عَلٰى شَيْءٍۖ وَقَالَتِ النَّصَارٰى لَيْسَتِ الْيَهُودُ عَلٰى شَيْءٍۙ وَهُمْ يَتْلُونَ الْكِتَابَۜ كَذٰلِكَ قَالَ الَّذِينَ لَا يَعْلَمُونَ مِثْلَ قَوْلِهِمْۚ فَاللّٰهُ يَحْكُمُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ ﴿١١٣﴾ وَمَنْ اَظْلَمُ مِمَّنْ مَنَعَ مَسَاجِدَ اللّٰهِ اَنْ يُذْكَرَ فِيهَا اسْمُهُ وَسَعٰى فِي خَرَابِهَاۜ اُولٰٓئِكَ مَا كَانَ لَهُمْ اَنْ يَدْخُلُوهَٓا

---

**113) (وَقَالَتِ الْيَهُودُ) - yəhudilər dedilər: (لَيْسَتِ النَّصَارٰى عَلٰى شَيْءٍ) - xristianların özləri və dinləri bir şey** (haqq) **üzrə deyil. (وَقَالَتِ النَّصَارٰى) – xristianlar da dedilər: (لَيْسَتِ الْيَهُودُ عَلٰى شَيْءٍ ) - yəhudilərin özləri və dinləri bir şey** (haqq) **üzrə deyil. (وَهُمْ يَتْلُونَ الْكِتَابَ) - yəhudi və xristianlar bu sözü necə deyib bir-birilərinin dinlərini batil edirlər? Halbuki onlar elm əhli olub, Allah-Təalanın kitabını oxuyurlar, onlar gərək bir-birilərini təsdiq edib, Allah-Təalanın kitabını inkar etməsinlər. (كَذٰلِكَ) - yəhudi və xristianlar bir-birilərinin dinini batil edən kimi, (قَالَ الَّذِينَ لَا يَعْلَمُونَ مِثْلَ قَوْلِهِمْ) - cahil və nadan olan şəxslər** (müşriklər və bütpərəstlər) **də onların sözlərinin eynisini dedilər.** (Bizim dinimizdən başqası batildir - dedilər). **Elə isə əhli-kitabla müşriklər arasında nə fərq var?** (Bu kəlam əhli-kitabdan ötrü böyük məzəmmətdir, xristian və yəhudilər kitab və elm əhli olduqları halda, özlərini cahil müşriklərə bərabər tutdular)**. (فَاللّٰهُ يَحْكُمُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ) - Allah-Təala qiyamət günündə onların arasında hökm edər, (فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ) - o şeydə ki, ixtilaf edirdilər,** (bir-birilərini kafir edib dinlərini batil sayırdılar)**.** (Hz. Peyğəmbər öz səhabələri ilə Kəbəni ziyarət məqsədilə Mədinədən çıxıb, "Şəcərə" məscidində ehram bağlayıb yola düşdü. Elə ki Məkkənin yaxınlığında Hüdeybiyə adlı yerə çatdılar, orada müşriklər peyğəmbərin Məkkəyə daxil olmasına mane oldular. Hüdeybiyə qissəsi inşallah öz məqamında qeyd olunacaqdır). Hz. Peyğəmbər orada ehramdan çıxıb, Mədinəyə qayıtdı. Növbəti ayədə Allah-Təala bu mətləbi bəyan edir. (Yəni yəhudilər hərçənd peyğəmbəri və möminləri incidib onlara zülm edirdilər, amma onlardan daha zalım olan müşriklərdir, hansı ki peyğəmbərin və möminlərin Məscidül-harama daxil olub, orada Allah-Təalanı zikr etmələrinə mane oldular).

**114) (وَمَنْ اَظْلَمُ مِمَّنْ مَنَعَ مَسَاجِدَ اللّٰهِ اَنْ يُذْكَرَ فِيهَا اسْمُهُ) - kimdir o şəxslərdən daha zalım ki, Allah-Təalanın evlərində** (məscidlərdə) **Onun adının zikr edilməsinə mane oldular?** (Qüreyş camaatı Hz. Peyğəmbərin və onun səhabələrinin Məscidül-harama daxil olub, ibadət etməsinə mane oldular)**. (وَسَعٰى) - və səy etdilər, (فِي خَرَابِهَا) - o məscidlərin xarab olmasına.** (Müşriklərin Allah-Təalanın zikrinə mane olmaları məscidin xarab olmasından ibarətdir, çünki məscidin təmiri Allah-Təalaya ibadət etməklədir. Hansı məsciddə Allah-Təalaya ibadət olunmasa, o məscid viranə kimidir)**. (اُولٰٓئِكَ مَا كَانَ لَهُمْ اَنْ يَدْخُلُوهَٓا) - Allah-Təalanın adının məscidlərdə zikr edilməsinə mane olan-**

اِلَّا خَآئِفِينَ ۜ لَهُمْ فِي الدُّنْيَا خِزْيٌ وَلَهُمْ فِي الْاٰخِرَةِ عَذَابٌ عَظِيمٌ ﴿١١٤﴾ وَلِلّٰهِ الْمَشْرِقُ وَالْمَغْرِبُ
فَاَيْنَمَا تُوَلُّوا فَثَمَّ وَجْهُ اللّٰهِ ۜ اِنَّ اللّٰهَ وَاسِعٌ عَلِيمٌ ﴿١١٥﴾ وَقَالُوا اتَّخَذَ اللّٰهُ وَلَدًا ۙ سُبْحَانَهُ ۜ بَلْ لَهُ مَا فِي
السَّمٰوَاتِ وَالْاَرْضِ كُلٌّ لَهُ قَانِتُونَ ﴿١١٦﴾

---

**lardan ötrü məscidlərə daxil olmaq layiq deyildir. (اِلَّا خَآئِفِينَ) - ancaq Allah-Təaladan qorxduqları halda, gərək daxil olsunlar.** (Yəni mane olanların özləri də məscidlərə daxil olanda gərək Allah-Təalanı zikr edib qorxsunlar. Nəinki özləri Allah-Təalanı zikr etməyib, zikr edənlərə də məscidə daxil olmağa mane olsunlar. Necə ki Hz. Peyğəmbəri və onun səhabələrini Məscidül-harama buraxmayıb, Kəbəni tavaf etmələrinə mane oldular). **(لَهُمْ فِي الدُّنْيَا خِزْيٌ) – Hz. Peyğəmbəri və möminləri Məscidül-harama buraxmayıb, Allah-Təalanı zikr etmələrinə mane olanlardan ötrü dünyada zillət vardır.** (Belə ki bütün müşriklər möminlərin əlində zəlil olub, bəziləri əsir olub, bəziləri də öldürüldü). **(وَلَهُمْ فِي الْاٰخِرَةِ) - onlardan ötrü axirətdə (عَذَابٌ عَظِيمٌ) - böyük olan əzab vardır** (od əzabı var).

**115) (وَلِلّٰهِ الْمَشْرِقُ وَالْمَغْرِبُ) - məşriq və məğribin səltənəti Allah-Təalaya məxsusdur. (Müşriklərin siz möminlərin Məscidül-harama daxil olmanıza mane olmasından sizə heç bir zərər gəlməz. Harda Allah-Təalaya ibadət etsəniz, o məkan Allah-Təalaya məxsusdur. (فَاَيْنَمَا تُوَلُّوا) - harda ki Allah-Təalaya ibadət etdiniz və ibadət vaxtında üzünüzü Məscidül-harama və qiblə tərəfinə döndərdiniz, (فَثَمَّ وَجْهُ اللّٰهِ) - həmin tərəf Allah-Təalanın əmr etdiyi tərəfdir. Gərək ibadət vaxtı üzünüzü o tərəfə döndərəsiniz, ibadət məkanı Məscidül-haram oldu, ya başqa bir yer, heç bir fərqi yoxdur. Məqsəd Allah-Təalaya yönəlməkdir. Bu, harda olsa, demək məqsəd hasil olubdur. (اِنَّ اللّٰهَ وَاسِعٌ عَلِيمٌ) - həqiqətən, Allah-Təalanın rəhməti genişdir. Bütün məxluqatına şamildir. Xalqın xeyrinə agah olub, onlardan ötrü hər bir təklifini asan edibdir.**

(Yəhudilər dedilər: "Üzeyir Allah-Təalanın oğludur, xristianlar dedilər: İsa Allah-Təalanın oğludur". Müşriklər dedilər: "Mələklər Allah-Təalanın qızlarıdır". Allah-Təala növbəti ayədə onların sözlərini rədd edir).

**116) (وَقَالُوا اتَّخَذَ اللّٰهُ وَلَدًا) - yəhudi, xristian və müşriklər dedilər: Allah-Təala özünə övlad götürübdür. (سُبْحَانَهُ) - Allah-Təala bundan pak və müqəddəsdir.** (Çünki övlad sahibi olmaq məxluq kimi cism olmağı vacib edir. Allah-Təala məxluq kimi cism olmağın Ona isnad edilməsindən uca və qüsursuzdur). **(بَلْ لَهُ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) - əksinə, səmaların və yerin səltənəti Allah-Təalaya məxsusdur. Allah-Təala onların xaliqidir. Üzeyir, İsa və mələklər də Allah-Təalanın qulu və məxluqudurlar. Necə ola bilər ki, Allah-Təala onları özünə övlad etsin? (كُلٌّ لَهُ قَانِتُونَ) - bütün məxluqat Allah-**

بَديعُ السَّمٰوَاتِ وَالْاَرْضِ وَاِذَا قَضٰىٓ اَمْرًا فَاِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونَ ﴿١١٧﴾ وَقَالَ الَّذينَ لَا يَعْلَمُونَ
لَوْلَا يُكَلِّمُنَا اللّٰهُ اَوْ تَاْتينَٓا اٰيَةٌۜ كَذٰلِكَ قَالَ الَّذينَ مِنْ قَبْلِهِمْ مِثْلَ قَوْلِهِمْۜ تَشَابَهَتْ قُلُوبُهُمْۜ قَدْ بَيَّنَّا الْاٰيَاتِ
لِقَوْمٍ يُوقِنُونَ ﴿١١٨﴾ اِنَّٓا اَرْسَلْنَاكَ بِالْحَقِّ بَشيرًا وَنَذيرًاۙ وَلَا تُسْـَٔلُ عَنْ اَصْحَابِ الْجَحيمِ ﴿١١٩﴾

---

**Təalanın itaətində olub, Onun iradəsindən və ilahi qüdrətindən kənara çıxa bilməz.**

**117) (بَديعُ السَّمٰوَاتِ وَالْاَرْضِ) - səmaların və yerin Xaliqi, onları yoxdan yaradan Allah-Təaladır. (وَاِذَا قَضٰىٓ اَمْرًا) - Allah-Təalanın qüdrəti elə bir mərtəbədədir ki, nə zaman bir şeyin olmasını hökm etsə, (فَاِنَّمَا يَقُولُ لَهُ) - həqiqətən, o şeyə əmr edib deyər: (كُنْ فَيَكُونَ) – var ol, o şey də həmin an mövcud olar.** (Allah-Təalanın söz deməsindən məqsəd aləmin yaradılmasını istəməsi və hökm etməsidir. Yəni Xaliq olan Allah nəyin yaranmasını istəyib hökm etsə, o şey gecikmədən o anda mövcud olar).

**118) (وَقَالَ الَّذينَ لَا يَعْلَمُونَ) - cahil olan şəxslər dedilər: (لَوْلَا يُكَلِّمُنَا اللّٰهُ) - Allah-Təala niyə bizimlə danışmır? (اَوْ تَاْتينَٓا اٰيَةٌ) – ya da əgər Allah-Təala bizimlə danışmırsa, bizə bir möcüzə gəlsin ki,** (Məhəmmədin) **haqq olmağına işarə etsin.** (Quranın möcüzə olmasını inkar edib, başqa bir möcüzə xahiş etdilər, halbuki Qurandan böyük möcüzə olmaz, əgər başqa bir möcüzə də onlar üçün gəlsəydi, onu da inkar edəcəkdilər). **(كَذٰلِكَ) - müşriklər kimi, (قَالَ الَّذينَ مِنْ قَبْلِهِمْ مِثْلَ قَوْلِهِمْ) - müşriklərdən əvvəlki şəxslər də müşriklərin sözlərinin eynisini dedilər**. (Yəni Hz. Musa zamanında yəhudilər dedilər: "Ey Musa, biz Allah-Təalanı aşkar görmədikcə iman gətirmərik, ancaq o vaxt sənə iman gətirərik"). **(تَشَابَهَتْ قُلُوبُهُمْ) - bu müşriklərlə o yəhudilər qəlblərinin haqdan kor olması baxımından bir-birinə oxşardır. O səbəbdən hər ikisindən belə sözlər çıxır. (قَدْ بَيَّنَّا الْاٰيَاتِ) - həqiqətən, bəyan eləmişik ayə və möcüzələri, (لِقَوْمٍ يُوقِنُونَ) – elə bir qövmdən ötrü ki, insaf əhli olub Qurani-Şərifin Allah-Təala tərəfindən olmasını iqrar edib, möcüzə olmasına inansınlar.** (Amma müşriklər və yəhudilər insaf əhli olmadıqları üçün Qurani-Şərifin ayələrinə həqiqət üzrə baxmayıb, başqa möcüzələr istədilər).

(Yəhudilər və müşriklər iman etmədiklərindən peyğəmbərin təmiz qəlbi son dərəcə sıxılıb, qəmgin və məhzun oldu. Allah-Təala gələn ayədə Hz. Peyğəmbərə təsəlli verir).

**119) (اِنَّٓا اَرْسَلْنَاكَ بِالْحَقِّ بَشيرًا وَنَذيرًا)** – (ey Məhəmməd), **biz səni haqq və doğru olan cənnətlə müjdələyən, cəhənnəmlə qorxudan göndərmişik. Bundan başqa xalqın imana daxil olub-olmamasından sənə bir şey lazım deyil. (وَلَا تُسْـَٔلُ عَنْ اَصْحَابِ الْجَحيمِ) - cəhənnəm əhlinin əməllərindən sən sual olunmayacaqsan. Hər bir şəxsin əməlinin cəzası özünə veriləcəkdir. Sənin qəlbin xalqın imana daxil olub-olmamasından sıxılmasın, üzülmə.**

وَلَنْ تَرْضٰى عَنْكَ الْيَهُودُ وَلَا النَّصَارٰى حَتّٰى تَتَّبِعَ مِلَّتَهُمْ ۗ قُلْ اِنَّ هُدَى اللّٰهِ هُوَ الْهُدٰىۗ وَلَئِنِ اتَّبَعْتَ
اَهْوَٓاءَهُمْ بَعْدَ الَّذٖي جَٓاءَكَ مِنَ الْعِلْمِۙ مَا لَكَ مِنَ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ ﴿١٢٠﴾ اَلَّذٖينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ
يَتْلُونَهُ حَقَّ تِلَاوَتِهٖۜ اُو۬لٰٓئِكَ يُؤْمِنُونَ بِهٖۜ وَمَنْ يَكْفُرْ بِهٖ

---

**120) (**وَلَنْ تَرْضٰى عَنْكَ الْيَهُودُ وَلَا النَّصَارٰى**) –** (ey Məhəmməd)**, yəhudi və xristian tayfası heç vaxt səndən razı olmazlar. (**حَتّٰى تَتَّبِعَ مِلَّتَهُمْ**) – ta ki onların ümmətinə tabe olub, dinlərinə daxil olasan. O vaxt səndən razı olarlar. (**قُلْ**) – onlara de: (əgər sənə - gəl, bizim dinimizə tabe ol, desələr). (**اِنَّ هُدَى اللّٰهِ هُوَ الْهُدٰى**) - həqiqətən, Allah-Təalanın hidayəti** (islam) **haqq olan hidayətdir. (Amma siz yəhudi və xristianlar deyirsiniz ki, gəl, bizim dinimizə tabe ol. Bu, nəfsani arzudur. Allah-Təala Hz. Peyğəmbərin heç vaxt onların dininə tabe olmayacağını göstərmək, yəhudi və xristianların arzusunu batil etməkdən ötrü belə buyurur). (**وَلَئِنِ اتَّبَعْتَ اَهْوَٓاءَهُمْ بَعْدَ الَّذٖي جَٓاءَكَ مِنَ الْعِلْمِ**) -** (ey Məhəmməd)**, əgər sən islam haqq olub, Qurani-Şərif sənə nazil olandan sonra yəhudi və xristianların nəfsani istəklərinə və onların dininə tabe olsan,* (**مَا لَكَ مِنَ اللّٰهِ مِنْ وَلِيٍّ وَلَا نَصٖيرٍ**) - o vaxt Allah-Təala tərəfindən sənə nə bir dost, nə də bir kömək edən olmaz. Ta ki səni həlak olmaqdan xilas etsinlər.**

*(***Qeyd:** Uca peyğəmbərin qəlbində heç vaxt yəhudilərə və ya xristianlara tabe olmaq arzusu yox idi. Necə ola bilərdi ki, elə olsun, halbuki bütün millətlərin yanında o həzrətin zahiri və batini yeganə fikri islam dinini yayıb, bütün millətlərin sahiblərini özünə tabe edib, öz ümmətini bütün millətlər içində hakim etmək idi. Belə olan halda, necə ola bilər ki, o həzrətin qəlbində yəhudi və ya xristian dininə tabe olmaq fikri olaydı, halbuki özgə dinə tabe olmaq zillətdir və hakimiyyətə ziddir. Allah-Təala bu ayədə buyurur: "Əgər yəhudi və xristian dininə tabe olsan, o vaxt sənə Allah-Təaladan bir kömək olmaz",- necə ki qeyd olundu, bu mətləbi qeyd etməkdə məqsəd həm onların Hz. Peyğəmbərin onların dininə tabe olması ümidlərini yox etmək, həm də onları islama yönləndirməkdir. Çünki bu məqamda Hz. Peyğəmbər yəhudi və xristianlara deyə bilərdi: "Siz ki mənim sizin dininizə tabe olmamı xahiş edirsiniz, mən əgər meyil etsəm də, Allah-Təala razı deyildir. Belə olan halda necə ola bilər ki, mən sizin dininizə daxil olum? Bəs indi siz gəlin mənim dinimə daxil olun". Bu mətləb həm onların ümidini yox edir, həm də ola bilər ki, onların islama olan meyilini artırsın. Necə ki belə də oldu. Çünki belə məqamda Hz. Peyğəmbərin onlara şiddətlə qəti cavab verməsində hikmət var idi).*

**121) (**اَلَّذٖينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ**) - yəhudilərdən Qurana iman gətirən o şəxslərdir ki, onlara Tövratı göndərmişik. (**يَتْلُونَهُ حَقَّ تِلَاوَتِهٖ**) - Tövratı doğru şəkildə oxuyurlar, onda Hz. Peyğəmbərin qeyd olunan xüsusiyyətlərini dəyişdirməyib, Hz. Peyğəmbərə və Qurana iman gətirdilər. (**اُو۬لٰٓئِكَ يُؤْمِنُونَ بِهٖ**) - həqiqətən, onlar Tövrata iman gətirənlərdir,** (çünki Tövratın ehka-

فَاُولٰٓئِكَ هُمُ الْخَاسِرُونَ ﴿١٢١﴾ يَا بَنِيٓ اِسْرَآءِيلَ اذْكُرُوا نِعْمَتِيَ الَّتِيٓ اَنْعَمْتُ عَلَيْكُمْ وَاَنِّي فَضَّلْتُكُمْ عَلَى
الْعَالَمِينَ﴿١٢٢﴾ وَاتَّقُوا يَوْمًا لَا تَجْزِي نَفْسٌ عَنْ نَفْسٍ شَيْئًا وَلَا يُقْبَلُ مِنْهَا عَدْلٌ وَلَا تَنْفَعُهَا شَفَاعَةٌ
وَلَا هُمْ يُنْصَرُونَ ﴿١٢٣﴾

---

mına əməl etdilər). **(وَمَنْ يَكْفُرْ بِهٖ) - və kim Tövratı inkar etsə,** (yəni Tövratı dəyişdirib, onun ehkamına əməl etməsə), **(فَاُولٰٓئِكَ هُمُ الْخَاسِرُونَ) - dünya və axirətdə özlərinə zərər verənlər onlardır, çünki zəlaləti hidayətdən üstün saydılar). Bundan sonra gələn iki ayə Hz. Peyğəmbərin zamanında yaşayan yəhudilərə öyüd-nəsihətdir. Bu ayənin oxşarı surənin əvvəlində var idi. Yenidən təkid üçün bu məqamda qeyd olundu).**

**122) (يَا بَنِيٓ اِسْرَآءِيلَ اذْكُرُوا) - ey Yaqub oğulları, həmişə yadınıza salın, (نِعْمَتِيَ الَّتِيٓ اَنْعَمْتُ عَلَيْكُمْ) - mənim o nemətlərimi ki, sizə bəxş etmişəm. (وَاَنِّي فَضَّلْتُكُمْ عَلَى الْعَالَمِينَ) – sizə olan böyük nemətim budur ki, həqiqətən, siz bəni-İsraili aləmlərin məxluqatına üstün edib, Tövratı sizə nazil etmişəm, amma siz həmişə nankorluq edib, heç vaxt mənim nemətimə şükür etmədiniz.**

**123) (وَاتَّقُوا يَوْمًا) - ey bəni-İsrail, qorxun və çəkinin o bir günün** (qiyamət günü) **əzabından, (لَا تَجْزِي نَفْسٌ عَنْ نَفْسٍ شَيْئًا) – heç kim bir başqasının əvəzinə onun əməlinin cəzasını çəkməz.** (Sıradakı ayə yəhudilərdən müsəlman olan Abdullah ibn Salam və ona tabe olanlar haqqında nazil olub, çünki onlar Qurani-Şərifə iman gətirmişdilər). **(وَلَا يُقْبَلُ مِنْهَا عَدْلٌ) – o günahkardan əvəz qəbul olunmaz, (وَلَا تَنْفَعُهَا شَفَاعَةٌ) - o günahkar şəxsə heç bir şəfaət edənin şəfaəti mənfəət verməz. (وَلَا هُمْ يُنْصَرُونَ) - Allah-Təaladan başqa heç bir şəxs günahkar şəxslərə kömək edə bilməz.**

(Hz. İbrahimin (ə.s) fəzilətini bütün millət və məzhəb sahibləri iqrar edirlər, o həzrətin əsl mübarək adı Abramdır. Elə ki 99 yaşına çatdı, Allah-Təala ona övlad vəd etdi və ona belə xitab etdi: “Ey Abram, sənin övladını artırıb, sənin məxluqatdan bir çoxuna ata olmana qərar verdim. Bundan sonra sənin adın Abraham olsun, çünki sənin bir çox məxluqa ata olmana qərar vermişəm”. (Ərəblər bu adı ərəbləşdirib İbrahim etdilər). (Bəni-İsrail, ərəblərin əksəriyyəti və Avropa əhalisi Hz. İbrahimin övladıdır). Qurani-Şərifdə Hz. İbrahimin fəziləti çox yerdə qeyd edilib, uca peyğəmbərimizə də babası İbrahimin dininə tabe olmağı əmr edibdir. Sıradakı ayədə Hz. İbrahimin (ə.s) bütün məxluqata imam və rəhbər olması bəyan edilir. Yəhudilərin qissəsi ilə birlikdə Hz. İbrahimin (ə.s) qissəsini qeyd etməkdə məqsəd yəhudiləri agah etməkdir. Yəni ey yəhudi camaatı, necə ki Hz. İbrahim sizin babanızdır, habelə bu Hz. Məhəmmədin (ə.s) də babasıdır. Hz. Məhəmmədin (ə.s) şəriəti həmin Hz. İbrahimin şəriətidir. Övladın haqqı yaxşı əməldə ata-babaya tabe olmaqdır. Sizə də lazımdır ki, Hz. Məhəmmədə tabe olasınız, çünki ona tabe olmaq Hz. İbrahimə tabe olmaqdır).

وَاِذِ ابْتَلٰٓى اِبْرٰهِيمَ رَبُّهُ بِكَلِمَاتٍ فَاَتَمَّهُنَّ ۜ قَالَ اِنّ۪ي جَاعِلُكَ لِلنَّاسِ اِمَامًا ۜ قَالَ وَمِنْ ذُرِّيَّت۪ي ۜ قَالَ لَا يَنَالُ
عَهْدِي الظَّالِم۪ينَ ﴿١٢٤﴾ وَاِذْ جَعَلْنَا الْبَيْتَ مَثَابَةً لِلنَّاسِ وَاَمْنًا ۜ وَاتَّخِذُوا مِنْ مَقَامِ اِبْرٰه۪يمَ مُصَلًّى ۜ
وَعَهِدْنَٓا اِلٰٓى اِبْرٰه۪يمَ وَاِسْمٰع۪يلَ اَنْ طَهِّرَا بَيْتِيَ لِلطَّٓائِف۪ينَ وَالْعَاكِف۪ينَ وَالرُّكَّعِ السُّجُودِ ﴿١٢٥﴾

---

**124) (وَاِذِ ابْتَلٰٓى اِبْرٰه۪يمَ رَبُّهُ) - yadına sal,** (ey Məhəmməd)**, o zaman ki İbrahimin rəbbi Allah-Təala onu imtahan etdi, (بِكَلِمَاتٍ) - bəzi əmr və qadağaları ilə.** (Allah-Təala Hz. İbrahimə bəzi şeyləri əmr edib, bəzi şeyləri qadağan etdi)**. (فَاَتَمَّهُنَّ) - Hz. İbrahim o əmr və qadağalara gözəl şəkildə əməl edib, Allaha itaətdə o həzrətdən heç bir qüsur və nöqsan meydana gəlməmişdi. (قَالَ) - Allah-Təala Hz. İbrahimə bu xidmətinin əvəzində buyurdu: (اِنّ۪ي جَاعِلُكَ لِلنَّاسِ اِمَامًا ) - həqiqətən, mən səni bütün insan nəslinə imam və rəhbər təyin etdim.** (Hz. İbrahimdən sonra gələn peyğəmbərlərin hamısı onun nəslindən olub, hamısı Hz. İbrahimə tabe olublar)**. (قَالَ) - Hz. İbrahim ərz etdi: ilahi, (وَمِنْ ذُرِّيَّت۪ي) - necə ki məni xalqa imam və rəhbər təyin etdin, mənim nəslimdən də rəhbərlər təyin et. (قَالَ) - Allah-Təala buyurdu: (لَا يَنَالُ عَهْدِي الظَّالِم۪ينَ) - mənim əhdim və rəhbərlik vədim sənin nəslindən o şəxslərə yetişər ki, adil olub zalım olmasınlar.** (Bu ayə buna dəlildir ki, sultan və rəis gərək adil olsun, ədalətsiz və zalım olan şəxs heç vaxt hakimiyyətə layiq deyil. Əlbəttə, Allah-Təala razı olmaz ki, zalım olan şəxs öz bəndələrinə hakim olub, onlara bəla olsun).

**125) (وَاِذْ جَعَلْنَا الْبَيْتَ مَثَابَةً لِلنَّاسِ وَاَمْنًا) - yadına sal,** (ey Məhəmməd)**, o zaman ki biz Kəbəni Hz. İbrahimin zamanında hacılardan ötrü ziyarətgah və əmin-amanlıq yeri təyin etdik, kim ora daxil olsa, əmin-amanlıqda olub, heç kim onu oradan çıxara bilməsin. (وَاتَّخِذُوا مِنْ مَقَامِ اِبْرٰه۪يمَ مُصَلًّى) - Kəbə ziyarətinə gedənlərə əmr etdik ki, "məqami-İbrahim"də** (Hz. İbrahimin durduğu yerdə) **özünüzdən ötrü namazgah təyin edin. Nə vaxt Kəbəni tavaf etsəniz, ondan sonra tavaf namazını qılanda məqami-İbrahimdə də namaz qılın.** (Məscidül-haramın daxilində Kəbədən bir qədər aralıda kiçik bir binaya məqami-İbrahim deyilir. Həmin binanın arxa tərəfində tavaf namazı qılınır. O binanın məkanı Hz. İbrahimin ibadət etdiyi yerdir)**. (وَعَهِدْنَٓا اِلٰٓى اِبْرٰه۪يمَ وَاِسْمٰع۪يلَ) - və İbrahimə və İsmayıla əmr etdik, (اَنْ طَهِّرَا بَيْتِيَ) - mənim evimi (Kəbəni hər bir nəcisdən, bütlərdən) pak və müqəddəs edin ki, müşriklər oraya büt salmasınlar və xəbis olan şeylərdən oranı təmizləyib,** (cünüb və heyzli) **şəxslərin orada tavaf etməsinə mane olun. (لِلطَّٓائِف۪ينَ) - bu paklığı Kəbəni tavaf edənlərdən ötrü edin. (وَالْعَاكِف۪ينَ) - və orada qalıb həmişə ibadət edənlərdən ötrü, (وَالرُّكَّعِ السُّجُودِ) - rüku və səcdə edənlərdən ötrü, ta ki pak olan məkanda Allah-Təalaya ibadət etsinlər.**

وَاِذْ قَالَ اِبْرٰهِيمُ رَبِّ اجْعَلْ هٰذَا بَلَدًا اٰمِنًا وَارْزُقْ اَهْلَهُ مِنَ الثَّمَرَاتِ مَنْ اٰمَنَ مِنْهُمْ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ
قَالَ وَمَنْ كَفَرَ فَاُمَتِّعُهُ قَلِيلًا ثُمَّ اَضْطَرُّهُ اِلٰى عَذَابِ النَّارِ وَبِئْسَ الْمَصِيرُ ﴿١٢٦﴾ وَاِذْ يَرْفَعُ اِبْرٰهِيمُ
الْقَوَاعِدَ مِنَ الْبَيْتِ وَاِسْمٰعِيلُ رَبَّنَا تَقَبَّلْ مِنَّا اِنَّكَ اَنْتَ السَّمِيعُ الْعَلِيمُ ﴿١٢٧﴾ رَبَّنَا وَاجْعَلْنَا
مُسْلِمَيْنِ لَكَ

---

**126) (وَاِذْ قَالَ اِبْرٰهِيمُ) - yadına sal,** (ey Məhəmməd), **o zaman ki İbrahim dua məqamında Allah-Təalanı çağırıb dedi: (رَبِّ اجْعَلْ هٰذَا بَلَدًا اٰمِنًا) - ey mənim rəbbim, bu Məkkə şəhərini xalqdan ötrü əmin-amanlıq yeri et. Ta ki orada hər bir tərəfdən rahat olsunlar. (وَارْزُقْ اَهْلَهُ مِنَ الثَّمَرَاتِ) - bu Məkkə əhlinə hər növ meyvələrdən ruzi ver. (مَنْ اٰمَنَ مِنْهُمْ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) - o meyvələri Məkkə əhlindən o şəxslərə ruzi ver ki, Allah-Təalaya və axirət gününə iman gətirmiş olsunlar. (Hz. İbrahimin ancaq möminlər üçün ruzi xahiş etməsinin səbəbi odur ki, keçən ayədə övladlarından ötrü əmanət istədi. Allah-Təala buyurdu: əmanət zalımlara yetişməz. Burada Hz. İbrahim elə xəyal etdi ki, ruzi də əmanət kimi zalımlara çatan deyil. O səbəbdən ruzini ancaq möminlərdən ötrü xahiş etdi. Allah-Təala Hz. İbrahimin bu xahişini rədd edib buyurdu: kafirlərə də ruzi verirəm. Ruzi əmanət kimi deyildir. (قَالَ) - Allah-Təala buyurdu: (وَمَنْ كَفَرَ) - kim məni inkar etsə, (فَاُمَتِّعُهُ قَلِيلًا) - ona dünyada az bir zaman ruzi verərəm. (ثُمَّ اَضْطَرُّهُ) - dünyadan köçəndən sonra, onu zorla çəkərəm, (اِلٰى عَذَابِ النَّارِ) - od əzabının tərəfinə, (وَبِئْسَ الْمَصِيرُ) - onun qayıdacağı yer** (cəhənnəm) **nə pis yerdir.**

**127) (وَاِذْ يَرْفَعُ اِبْرٰهِيمُ الْقَوَاعِدَ مِنَ الْبَيْتِ وَاِسْمٰعِيلُ) - yadına sal** (ey Məhəmməd), **İbrahim (ə.s) Kəbənin* binasını oğlu İsmayılın yardımı ilə ucaldanda bu duanı edib deyirdilər: (رَبَّنَا تَقَبَّلْ مِنَّا ) - ey bizim rəbbimiz, bu xidməti bizdən qəbul et. (اِنَّكَ اَنْتَ السَّمِيعُ الْعَلِيمُ) - həqiqətən, bizim dualarımızı eşidən və bizim qəlbimizə və niyyətlərimizə agah olan sənsən ki, bu əməli məhz səndən ötrü edib, heç bir şəxsdən əcr və muzd təmənnamız yoxdur.**

*(***Qeyd:** Kəbəni Hz. İbrahim tikib, Hz. İsmayılın yardımı ilə tamamladı. Yer üzündə Allah-Təaladan ötrü tikilən ilk ibadətxana oradır. Hz. İbrahim Hz. İsmayılı anası Həcərlə orada məskun edib, İsmayıl ərəb tayfası olan bəni-Cürhümdən qız aldı. Özü və özündən bir qədər sonra övladları Kəbədə Allah-Təalaya ibadət etdilər. Ondan sonra zaman keçib, İsmayılın nəsli olan Qüreyş camaatının arasında bütpərəstlik zahir oldu. Yəmənə ticarət üçün gedən qüreyşlilər Yəməndən büt gətirib, Kəbəni bütxanaya çevirdilər. Allah-Təala Qüreyşin içindən Hz. Məhəmməd ibn Abdullahı (ə.s) seçənə qədər ora bütxana kimi qaldı. O, Kəbəni bütxana olmaqdan çıxarıb, ancaq Allaha ibadətxana edib, xalqdan ötrü tavaf yeri etdi. Bugünkü günə kimi də belədir. (Allah o müqəddəs yeri bidətlərdən qorusun!)*

**128) (رَبَّنَا وَاجْعَلْنَا) - ey bizim tərbiyə verən Rəbbimiz,** (ata və oğul) **hər ikimizi et, (مُسْلِمَيْنِ لَكَ) – təkcə sənə itaət və ibadət edən ki, heç bir şəkildə**

وَمِنْ ذُرِّيَّتِنَآ اُمَّةً مُسْلِمَةً لَكَۖ وَاَرِنَا مَنَاسِكَنَا وَتُبْ عَلَيْنَاۚ اِنَّكَ اَنْتَ التَّوَّابُ الرَّحِيمُ ﴿١٢٨﴾ رَبَّنَا وَابْعَثْ فِيهِمْ رَسُولًا مِنْهُمْ يَتْلُوا عَلَيْهِمْ اٰيَاتِكَ وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَيُزَكِّيهِمْۜ اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْحَكِيمُ۟ ﴿١٢٩﴾ وَمَنْ يَرْغَبُ عَنْ مِلَّةِ اِبْرٰهِيمَ اِلَّا مَنْ سَفِهَ نَفْسَهُۜ وَلَقَدِ اصْطَفَيْنَاهُ فِي الدُّنْيَاۚ وَاِنَّهُ فِي الْاٰخِرَةِ لَمِنَ الصَّالِحِينَ ﴿١٣٠﴾

---

**onda riya olmasın. (وَمِنْ ذُرِّيَّتِنَآ اُمَّةً مُسْلِمَةً لَكَ) – habelə bizim nəslimizdən bir camaatı ancaq sənə ibadət və itaət edən et, (وَاَرِنَا مَنَاسِكَنَا) - bizə həccimizin əməllərini öyrət ki, həcci necə yerinə yetirək. ( وَتُبْ عَلَيْنَا) - tövbə edəndə tövbəmizi qəbul et. (اِنَّكَ اَنْتَ التَّوَّابُ الرَّحِيمُ) - həqiqətən, tövbələri qəbul edib, rəhm edən sənsən.**

**129) (رَبَّنَا وَابْعَثْ فِيهِمْ رَسُولًا مِنْهُمْ) - ey bizim tərbiyə verən Rəbbimiz, Məkkə əhlinin öz içindən onlara bir peyğəmbər göndər. (يَتْلُوا عَلَيْهِمْ اٰيَاتِكَ) –ta ki sənin ayə və ehkamlarını Məkkə əhlinə çatdırsın. (وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ) - sənin tərəfindən gətirdiyi kitab və hikməti Məkkə əhlinə öyrətsin. (وَيُزَكِّيهِمْ) - bütün xəbis olan xüsusiyyətlərdən və şirkdən onları pak etsin. (اِنَّكَ اَنْتَ الْعَزِيزُ الْحَكِيمُ) - həqiqətən, bütün məxluqata qalib olan sənsən və hər bir əməl səndən hikmət üzrə meydana gələr. (Hz. İbrahimin duasındakı peyğəmbər bizim uca peyğəmbərimizdir. Allah-Təala Hz. İbrahimin duasını qəbul edib, Məkkə əhlindən olan o həzrəti peyğəmbər etdi. Necə ki o həzrət özü buyurubdur: “Atam İbrahimin dua edib, xahiş etdiyi peyğəmbər mənəm”. Bir də Məkkədə və Məkkə əhlindən ondan başqa, heç bir şəxs peyğəmbərlik iddiası etməyib. Hz. İbrahimin istədiyi peyğəmbər Hz. Məhəmməd ibn Abdullah** (s.ə.s) **olub, bu xəbər peyğəmbərimizin doğruluğuna böyük dəlildir.**

(İslam dini və ümməti həmin Hz. İbrahimin dini və ümməti olduğundan Allah-Təala gələn ayədə islamdan üz döndərən yəhudiləri məzəmmət edir ki, niyə yəhudilər Hz. İbrahimin dinindən kənar olub, Hz. Məhəmmədə iman gətirmirlər, halbuki deyirlər: “Biz İbrahimin övladlarıyıq”. Belə əməl ancaq səfeh şəxslərə məxsusdur).

**130) (وَمَنْ يَرْغَبُ عَنْ مِلَّةِ اِبْرٰهِيمَ) - kimdir o şəxs ki, İbrahimin dinindən kənar olub üz döndərsin? (Əlbəttə, heç bir şəxs kənar olmaz), ( اِلَّا مَنْ سَفِهَ نَفْسَهُ) - ancaq o şəxs** (kənar olar) **ki, özünü zəlil və həqir edib, özünü aqillərdən kənarlaşdırıb cahillərin sırasına daxil edər.** (Necə ola bilər ki, bir şəxs Hz. İbrahimin ümmətindən kənar olsun?) **(وَلَقَدِ اصْطَفَيْنَاهُ فِي الدُّنْيَا) - həqiqətən, biz onu dünyada insanların içindən seçib, özümüzə dost etmişik. (وَاِنَّهُ فِي الْاٰخِرَةِ لَمِنَ الصَّالِحِينَ) - həqiqətən, İbrahim axirətdə də saleh şəxslərdəndir. (O şəxslərdəndir ki, qiyamət günündə onların xeyir əməlinə şəhadət edilər).**

اِذْ قَالَ لَهُ رَبُّهُ اَسْلِمْ قَالَ اَسْلَمْتُ لِرَبِّ الْعَالَمِينَ ﴿١٣١﴾ وَوَصّٰى بِهَٓا اِبْرٰهِيمُ بَنِيهِ وَيَعْقُوبُ يَا بَنِيَّ اِنَّ اللّٰهَ اصْطَفٰى لَكُمُ الدِّينَ فَلَا تَمُوتُنَّ اِلَّا وَاَنْتُمْ مُسْلِمُونَ ﴿١٣٢﴾ اَمْ كُنْتُمْ شُهَدَٓاءَ اِذْ حَضَرَ يَعْقُوبَ الْمَوْتُ اِذْ قَالَ لِبَنِيهِ مَا تَعْبُدُونَ مِنْ بَعْدِي قَالُوا نَعْبُدُ اِلٰهَكَ وَاِلٰهَ اٰبَائِكَ اِبْرٰهِيمَ وَاِسْمٰعِيلَ وَاِسْحٰقَ اِلٰهًا وَاحِدًا وَنَحْنُ لَهُ مُسْلِمُونَ ﴿١٣٣﴾

---

**Bir şəxs ki dünya və axirətin xeyri onda toplanıb, onun tərəqqipərvər ümmətindən kənar olmaq ən böyük səfehlikdir. Bəs niyə yəhudilər Hz. İbrahimin dini olan islamdan kənar olurlar? Halbuki özlərini ağıllı hesab edirlər.**

**131) (اِذْ قَالَ لَهُ رَبُّهُ اَسْلِمْ) - Hz. İbrahimin xalqın içindən seçilməsi o səbəbə görədir ki, Allah-Təala ona demişdi: "Müsəlman olub Allah-Təalaya itaət et". (Allah-Təalanın İbrahimə bunu deməsi ancaq söz ilə deyildir. Bəlkə o dəlillər ki, onlarla Allah-Təalanı bilib, müvəhhid olmaq olar, Hz. İbrahim ağlı ilə o dəlilləri düşünüb, müvəhhid oldu. (قَالَ اَسْلَمْتُ لِرَبِّ الْعَالَمِينَ) – Hz. İbrahim Allah-Təalanın cavabına dedi: "Bütün aləmlərin tərbiyə verən Rəbbinə itaət etdim".**

**132) (وَوَصّٰى بِهَٓا اِبْرٰهِيمُ بَنِيهِ) - Hz. İbrahim elə ki özü müsəlman olub, itaətkar müvəhhid oldu, islam dinində olmağı** (tövhidi) **oğlanlarına vəsiyyət etdi. (وَيَعْقُوبُ) - habelə Yaqub da oğlanlarına islamı vəsiyyət etdi. (يَا بَنِيَّ) - İbrahim və Yaqub öz oğullarına dedilər: "Ey mənim oğullarım, (اِنَّ اللّٰهَ اصْطَفٰى لَكُمُ الدِّينَ) - həqiqətən, Allah-Təala bütün dinlərin içindən sizin üçün islamı din seçibdir. (فَلَا تَمُوتُنَّ) – ölüm sizə gəlməsin, (اِلَّا وَاَنْتُمْ مُسْلِمُونَ) - ancaq islamda sabit və bərqərar olduğunuz halda** (ölüm sizə gəlsin)**".**

**133) (اَمْ كُنْتُمْ شُهَدَٓاءَ) - ey yəhudi camaatı, bəs əvvəlki peyğəmbərlərin yəhudiliyini iddia edib deyirsiniz ki, o peyğəmbərlər yəhudi olublar, Üzeyri Allah-Təalanın oğlu biliblər, əgər bunu iddianı edirsinizsə, bu iddia batildir. Yoxsa siz orada idiniz, (اِذْ حَضَرَ يَعْقُوبَ الْمَوْتُ) - o vaxt ki ölüm Yaquba gəldi, (اِذْ قَالَ لِبَنِيهِ) - o zaman ki Yaqub oğlanlarına dedi: (مَا تَعْبُدُونَ مِنْ بَعْدِي) - məndən sonra nəyə ibadət edəcəksiniz? (قَالُوا نَعْبُدُ اِلٰهَكَ) - Yaqubun oğlanları dedilər: ibadət edirik sənin tanrına. (وَاِلٰهَ اٰبَائِكَ اِبْرٰهِيمَ وَاِسْمٰعِيلَ وَاِسْحٰقَ) - və sənin ataların olan İbrahimin, İsmailin və İshaqın tanrısına, (اِلٰهًا وَاحِدًا) - yeganə olan Allah-Təalaya ibadət edirik. (وَنَحْنُ لَهُ مُسْلِمُونَ) - bir olan Allah-Təalaya itaət edib, onu yeganə məbud bilib, ona şərik qoşmarıq.** (Ey yəhudi camaatı, hərçənd siz Hz. Yaqub bu vəsiyyəti edəndə orada yox idiniz, amma babalarınız orada olub, bu vəsiyyət onlardan sizə çatıbdır. Bəs niyə batil iddia edib, peyğəmbərlərə yəhudiliyi, Üzeyirə Allah-Təalanın oğlu olduğunu isnad edirsiniz?)

تِلْكَ اُمَّةٌ قَدْ خَلَتْۚ لَهَا مَا كَسَبَتْ وَلَكُمْ مَا كَسَبْتُمْۚ وَلَا تُسْـَٔلُونَ عَمَّا كَانُوا يَعْمَلُونَ ﴿١٣٤﴾ وَقَالُوا
كُونُوا هُودًا اَوْ نَصَارٰى تَهْتَدُواۜ قُلْ بَلْ مِلَّةَ اِبْرٰهِيمَ حَنِيفًاۜ وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ ﴿١٣٥﴾ قُولُوٓا
اٰمَنَّا بِاللّٰهِ وَمَٓا اُنْزِلَ اِلَيْنَا

---

**134) (تِلْكَ اُمَّةٌ) - İbrahim, Yaqub və onların övladları bir ümmətdir, (قَدْ خَلَتْ) - həqiqətən, sizdən əvvəl keçib gediblər. (لَهَا مَا كَسَبَتْ) - onlara öz etdikləri xeyir əməllər fayda verər, (وَلَكُمْ مَا كَسَبْتُمْ) - və sizə ey yəhudilər, öz qazandığınız xeyir əməllər fayda verər. Peyğəmbər övladı olmaqla niyə fəxr edirsiniz? Peyğəmbər övladı olmaq * sizə bir fayda verməz.**

*(****Qeyd:*** Yəhudilər fəxr edib deyirdilər: "Biz peyğəmbər övladıyıq, Allah-Təala yanında bizim şərəf və mərtəbəmiz bütün millətlərdən artıqdır". Necə ki indi bəni-Haşimilər deyir. Allah-Təalanın və Hz. Peyğəmbərin sözlərini unudub soy-nəsəbləri ilə fəxr edirlər, halbuki Allah-Təala ayədə buyurur: "Allah-Təala yanında ən xeyirliniz Ondan ən çox qorxanınızdır" (Hucurat 49/13). Uca peyğəmbərimiz buyurub: "Ey bəni-Haşim, elə olmasın ki, qiyamət günündə xalq öz yaxşı əməlləri ilə fəxr etdikləri halda mənim yanıma gəlsinlər, amma siz gələsiniz öz soy kökünüzlə fəxr etdiyiniz halda və deyəsiniz: bizik bəni-Haşim və səninlə soyumuz birdir. Qiyamət günündə heç kimə öz əməlindən başqa şey mənfəət verməz" (Əhməd b. Hənbəl, Müsnəd)).*

**(وَلَا تُسْـَٔلُونَ) – siz yəhudilər sorğu-sual olunmazsınız, (عَمَّا كَانُوا يَعْمَلُونَ) - əvvəlki ümmətlərin etdiyi əməllərdən, əgər onlar pis əməl də etsələr, ondan sizə bir zərər yoxdur. Siz öz əməlinizdən sorğu-sual olunacaqsınız.**

**135) (وَقَالُوا) - yəhudi və xristianlar müsəlmanlara dedilər: (كُونُوا هُودًا) - yəhudilər dedilər: "Ey müsəlmanlar, yəhudi məzhəbində olun, əsl din yəhudi dinidir". (اَوْ نَصَارٰى) - xristianlar dedilər: "Xristian məzhəbində olun, əsl din xristian dinidir. (تَهْتَدُوا) - o vaxt haqq tərəfinə hidayət taparsınız". (قُلْ) – (ey Məhəmməd, onların cavabında de: "Siz deyirsiniz ki, bu, haqq olan din deyildir. (بَلْ مِلَّةَ اِبْرٰهِيمَ) - əksinə, haqq olan din İbrahimin dinidir. Siz gəlin İbrahimin dininə daxil olun. (حَنِيفًا) - bir halda ki, Hz. İbrahim bütün batil olan din və məzhəblərdən keçib haqq olan dinin tərəfinə yönəldi. O haqq olan dini ki Hz. İbrahim seçib, həmin bu din islamdır ki, mən sizi o dinin tərəfinə dəvət edirəm. (وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ) – Hz. İbrahim müşriklərdən olmayıb, əksinə, müvəhhidlərin ilki idi.** (Amma siz yəhudilər və xristianlar müşriksiniz. Çünki siz yəhudilər deyirsiniz: Üzeyir Allahın oğludur və siz xristianlar deyirsiniz: İsa Allah-Təalanın oğludur, bu din Hz. İbrahimin dini deyil. Halbuki Hz. İbrahim müşriklərdən deyil idi". Növbəti ayə möminlərə xitabdır).

**136) (قُولُوٓا) –** (ey möminlər), **yəhudi və xristianların müqabilində deyin: (اٰمَنَّا بِاللّٰهِ) - iman gətirdik Allah-Təalaya, (وَمَٓا اُنْزِلَ اِلَيْنَا) - və o Qurana ki,**

وَمَآ اُنْزِلَ اِلٰىٓ اِبْرٰهِيمَ وَاِسْمٰعِيلَ وَاِسْحٰقَ وَيَعْقُوبَ وَالْاَسْبَاطِ وَمَآ اُو۫تِيَ مُوسٰى وَعِيسٰى وَمَآ اُو۫تِيَ
النَّبِيُّونَ مِنْ رَبِّهِمْۚ لَا نُفَرِّقُ بَيْنَ اَحَدٍ مِنْهُمْۘ وَنَحْنُ لَهُ مُسْلِمُونَ ﴿١٣٦﴾ فَاِنْ اٰمَنُوا بِمِثْلِ مَآ اٰمَنْتُمْ
بِهٖ فَقَدِ اهْتَدَوْاۚ وَاِنْ تَوَلَّوْا فَاِنَّمَا هُمْ فِي شِقَاقٍۚ فَسَيَكْفِيكَهُمُ اللّٰهُۚ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿١٣٧﴾ صِبْغَةَ
اللّٰهِۚ وَمَنْ اَحْسَنُ مِنَ اللّٰهِ صِبْغَةًۘ

---

**bizə nazil olub, (وَمَآ اُنْزِلَ اِلٰىٓ اِبْرٰهِيمَ وَاِسْمٰعِيلَ وَاِسْحٰقَ وَيَعْقُوبَ وَالْاَسْبَاطِ) - və o hökmlərə ki, bu qeyd olunan peyğəmbərlərə və Yaqubun övladlarından olan peyğəmbərlərə nazil olubdur, (وَمَآ اُو۫تِيَ مُوسٰى وَعِيسٰى) – və o Tövrat və İncilə ki, Musaya və İsaya verilibdir, (وَمَآ اُو۫تِيَ النَّبِيُّونَ مِنْ رَبِّهِمْ) - və o hökmlərə ki, öz rəbləri Allah-Təaladan bütün peyğəmbərlərə verilibdir. (لَا نُفَرِّقُ بَيْنَ اَحَدٍ مِنْهُمْ) - heç kim peyğəmbərlərin arasında fərq qoymayıb, Allah-Təala tərəfindən gələn hər bir peyğəmbərə iman gətirmişik. (وَنَحْنُ لَهُ مُسْلِمُونَ) – biz Allah-Təalaya itaət edib müvəhhid olan şəxslərik, siz yəhudi və xristianlar deyilsiniz.**

**137) (فَاِنْ اٰمَنُوا) - əgər yəhudilər iman gətirsəydilər, (بِمِثْلِ مَآ اٰمَنْتُمْ بِهٖ) - o dinə ki, siz möminlər ona iman gətiribsiniz, (فَقَدِ اهْتَدَوْا) - həqiqətən, hidayət tapardılar,** (əgər yəhudilər də siz möminlər kimi islama iman gətirsəydilər, o vaxt hidayət və nicat tapardılar). **(وَاِنْ تَوَلَّوْا) - əgər islamdan üz döndərsələr, (فَاِنَّمَا هُمْ فِي شِقَاقٍ) - həqiqətən, yəhudilərin adəti həmişə inad və ədavət içində olmaqdır. (فَسَيَكْفِيكَهُمُ اللّٰهُ) – tezliklə Allah-Təala özü yəhudilərə kifayət edib, özü onlardan intiqam alar.** (Bu, Allah-Təalanın peyğəmbərinə olan vədidir, yəni ey Məhəmməd, ürəyini sıxma, sənin intiqamını yəhudilərdən alıb səni onlara qalib edəcəyəm. Bir müddət sonra Allah-Təalanın vədi reallaşdı, peyğəmbərimiz yəhudilərə qalib oldu. Yəhudilərin iki böyük tayfası - bəni-Qüreyzə və bəni-Nəzir peyğəmbərimizin əlində zəlil oldular). **(وَهُوَ السَّمِيعُ الْعَلِيمُ) - yəhudilərin kəlamlarını eşidib, onların qəlblərində olan kin, həsəd və ədavətə agah olan Allah-Təaladır.** (Xristianların övladı olanda onu sarı rəngli bir suyun içində qüsl edərdilər. O suyun adına “mamudiyyə” (vaftiz) deyirdilər. Uşağı qüsl edəndən sonra deyərdilər: “İndi bu uşaq həqiqi xristian oldu”. Möminlərə Allah-Təala tərəfindən əmr olundu ki, xristianlara belə desinlər: “Övladınızı sarı suda qüsl edib, ondan sonra deyirsiniz: bu uşaq bu sarı suda qüsl edilməklə həqiqi xristian olub, Allah-Təalaya yaxınlaşdı. Əslində, sizin dediyiniz kimi deyil”).

**138) (صِبْغَةَ اللّٰهِ) - əksinə, Allah-Təalanın imanı səbəbi ilə bir şəxsə rəng verməsi onun Allah-Təalaya yaxınlaşmasına səbəbdir. Nəinki sizin rəng verməyiniz. (وَمَنْ اَحْسَنُ مِنَ اللّٰهِ صِبْغَةً) - Allah-Təaladan yaxşı və gözəl rəng verən kimdir?** (Allah-Təalanın rəngi əsl imanla olub həmişə sabit və bərqərar olar. Amma siz xristianların rəngi nisbidir. Heç kim heç vaxt onunla Allah-

وَنَحْنُ لَهُ عَابِدُونَ ﴿١٣٨﴾ قُلْ اَتُحَآجُّونَنَا فِي اللّٰهِ وَهُوَ رَبُّنَا وَرَبُّكُمْۚ وَلَنَآ اَعْمَالُنَا وَلَكُمْ اَعْمَالُكُمْۚ وَنَحْنُ لَهُ
مُخْلِصُونَۙ ﴿١٣٩﴾ اَمْ تَقُولُونَ اِنَّ اِبْرٰهِيمَ وَاِسْمٰعِيلَ وَاِسْحٰقَ وَيَعْقُوبَ وَالْاَسْبَاطَ كَانُوا هُودًا اَوْ نَصَارٰىۜ
قُلْ ءَاَنْتُمْ اَعْلَمُ اَمِ اللّٰهُۜ وَمَنْ اَظْلَمُ مِمَّنْ كَتَمَ شَهَادَةً عِنْدَهُ مِنَ اللّٰهِۜ وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ﴿١٤٠﴾

---

Təalaya yaxınlaşa bilməz). **(وَنَحْنُ لَهُ عَابِدُونَ) - Allah-Təalaya əsl ibadət edən bizik. Siz xristianlar deyilsiniz.**

**139) (قُلْ اَتُحَآجُّونَنَا فِي اللّٰهِ) -** (ey Məhəmməd)**, yəhudilərə de ki, bəs Allah-Təala haqqında bizimlə mübahisə və münaqişə edib deyirsiniz: "Niyə ərəblərdən peyğəmbər göndərdi, əgər Allah-Təala peyğəmbər göndərsə, gərək bizdən olaydı. (وَهُوَ رَبُّنَا وَرَبُّكُمْ) –** (ey yəhudilər)**, Allah-Təala həm bizim rəbbimiz, həm sizin rəbbinizdir. Bir şəxs ərəb, ya da əcəm olsa, öz lütfü ilə onu peyğəmbər edər. Heç kim ona etiraz edə bilməz. (وَلَنَآ اَعْمَالُنَا وَلَكُمْ اَعْمَالُكُمْ) - bizə öz əməllərimiz, siz yəhudilərə də öz əməlləriniz fayda verər.** (Əgər əmələ görə deyirsinizsə, yaxşı əməl bizdən meydana gəlir, o səbəbdən gərək peyğəmbər bizdən olsun. Habelə o yaxşı əməllər ki, bizdən meydana gəlir, niyə bizdən peyğəmbər gəlməsin?) **halbuki (وَنَحْنُ لَهُ مُخْلِصُونَ) - Allah-Təalaya ixlasla iman edib, müvəhhid olub, Ona şərik qoşmayan bizik, siz yəhudilər deyilsiniz".**

**140) (اَمْ تَقُولُونَ اِنَّ اِبْرٰهِيمَ وَاِسْمٰعِيلَ وَاِسْحٰقَ وَيَعْقُوبَ وَالْاَسْبَاطَ ) – ya da siz yəhudi və xristianlar deyirsiniz ki, həqiqətən, qeyd olunan peyğəmbərlər və Yaqubun övladından olan peyğəmbərlər (كَانُوا هُودًا) - hamısı yəhudidir,** (yəni yəhudi dinində idilər)**, (اَوْ نَصَارٰى) - ya da siz xristianlar deyirsiniz ki, bu peyğəmbərlərin hamısı xristiandır,** (yəni xristian dinində idilər). **(قُلْ) – onlara de ki,** (ey Məhəmməd)**, (ءَاَنْتُمْ اَعْلَمُ اَمِ اللّٰهُ) - siz bilirsiniz, yoxsa Allah-Təala? Siz deyirsiniz ki, peyğəmbərlər yəhudi və xristian idi, amma Allah-Təala şəhadət edir ki, onların dini islamdır.** (Siz özünüz agahsınız ki, Hz. İbrahim və ondan sonra gələn peyğəmbərlərin hamısı islam dini üzrə olublar. Bu din ki Hz. Məhəmməd (ə.s) gətiribdir, elə Hz. İbrahimin dinidir. Amma siz gizlədib, şəhadət etmirsiniz). **(وَمَنْ اَظْلَمُ مِمَّنْ كَتَمَ شَهَادَةً عِنْدَهُ مِنَ اللّٰهِ) - bir şəxs ki, onun yanında Allah-Təalanın verdiyi xəbərə şəhadət edilib, o, şəhadəti gizlədib şəhadət verməsə, o şəxsdən daha zalım olan kimdir?** (Allah-Təalanın verdiyi xəbərlə agah olubsunuz ki, Hz. Məhəmməd (ə.s), Allah-Təala tərəfindən haqq olan peyğəmbərdir, necə ki Tövratda sizə xəbər verilib, amma siz bu xəbəri gizlədib, şəhadət etmirsiniz). **(وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ) - o şeyləri ki, siz edirsiniz, Allah-Təala onlardan qafil olan deyildir. Haqqa şəhadət etməyib Hz. Məhəmmədin xüsusiyyətlərini Tövratda gizlədib, dəyişdirib, bəyan etmirsiniz.** (Necə ki özlərini müsəlman sayanlar haqqı gizlədib, Allah-Təalanın kitabının xilafına hökm verib, özlərini bu ayənin ehtivasına daxil edib, zülmün ən son dərəcəsi ilə vəsfləndilər).

تِلْكَ اُمَّةٌ قَدْ خَلَتْۚ لَهَا مَا كَسَبَتْ وَلَكُمْ مَا كَسَبْتُمْۚ وَلَا تُسْـَٔلُونَ عَمَّا كَانُوا يَعْمَلُونَ۟ ﴿١٤١﴾ سَيَقُولُ السُّفَهَٓاءُ مِنَ النَّاسِ مَا وَلّٰيهُمْ عَنْ قِبْلَتِهِمُ الَّت۪ي كَانُوا عَلَيْهَاۜ قُلْ لِلّٰهِ الْمَشْرِقُ وَالْمَغْرِبُۜ يَهْد۪ي مَنْ يَشَٓاءُ اِلٰى صِرَاطٍ مُسْتَق۪يمٍ ﴿١٤٢﴾

---

**141) (تِلْكَ اُمَّةٌ قَدْ خَلَتْ) – Hz. İbrahim və onun övladları elə bir ümmətdir ki, sizdən əvvəl keçib gediblər. (لَهَا مَا كَسَبَتْ) – etdikləri hər bir xeyir əməl onların özlərinə fayda verər. Onların əməllərindən siz yəhudilərə bir fayda gəlməz. (وَلَكُمْ مَا كَسَبْتُمْ) - sizə də öz qazandığınız xeyir əməllər fayda verər. (وَلَا تُسْـَٔلُونَ عَمَّا كَانُوا يَعْمَلُونَ) - keçən ümmətlərin etdikləri əməllərdən sorğu-sual olunmazsınız.** (Əgər keçən ümmətlərdən bir şər əməl meydana gəlsə, ondan sizə bir zərər gəlməz. Necə ki onların xeyir əməllərinin də sizə bir faydası olmaz. Hər bir şəxsin əməlinin cəzası və ya mükafatı onun özünə aiddir. Ey yəhudilər qürrələnməyin ki, Hz. İbrahim və övladları olan peyğəmbərlər sizin babalarınızdır. Onların əməlindən sizə heç bir fayda gəlməz. Hər şəxsə öz əməli fayda verər. Bu ayənin oxşarı bundan əvvəl keçdi. İkinci dəfə bu ayənin təkrarlanmasında məqsəd təkidlə qeyd etməkdir ki, heç kim gərək özündən başqasının əməli ilə qürrələnməsin. Ata-babanın şərəfi və fəziləti övlada fayda verməz. ("Atan oldusa sənin, əgər "fazil", Atanın fəzlindən sənə nə hasil?") Uca peyğəmbərimiz Məkkədə olanda namazı Kəbəyə doğru qılardı. Mədinəyə hicrət edildikdən sonra Allah-Təala tərəfindən namazı Beytül-müqəddəsə (Qüds) tərəf qılmaqla əmr olundu. Amma peyğəmbərin qəlbində həmişə bu arzu var idi ki, namazı Kəbəyə doğru qılsın. (Buxari, İman 30; Müslüm, Məsacid 525) Çünki ora babası İbrahimin qibləsi və ərəblərin tavaf yeri idi. Allah-Təala sıradakı ayədə qiblənin dəyişdirildiyini öz peyğəmbərinə elan edir: "Ey Məhəmməd, agah ol ki, sən Beytül-müqəddəsdən dönüb Kəbəyə doğru namaz qılanda yəhudilər sənə istehza edib, tənəli sözlər danışırlar. O zaman sən də onlara cavab verməyə hazır ol).

**142) (سَيَقُولُ السُّفَهَٓاءُ مِنَ النَّاسِ)** – (ey Məhəmməd, o vaxt ki sənə əmr edildi, bundan sonra namazı Kəbəyə doğru qılmayasan, yəhudi olan) **səfeh şəxslər deyərdilər: (مَا وَلّٰيهُمْ) - peyğəmbəri və ona tabe olanları nə döndərdi, (عَنْ قِبْلَتِهِمُ الَّت۪ي كَانُوا عَلَيْهَا) - o qiblədən ki, onun** (Beytül-müqəddəs) **tərəfinə namaz qılırdılar? (قُلْ لِلّٰهِ الْمَشْرِقُ وَالْمَغْرِبُ)** – (ey Məhəmməd)**, o zaman onların cavabında de: məşriq və mərğib, hər ikisi Allah-Təalanın mülküdür.** (Öz mülkündə istədiyi kimi hərəkət edər. Bəzən Kəbəni, bəzən Beytül-müqəddəsi qiblə təyin edər, Onun hikmətinə siz agah deyilsiniz. Kəbədə, ya da Beytül-müqəddəsdə heç bir ilahi xüsusiyyət yoxdur. Çünki hər ikisi daş və torpaqdır. Heç biri Allah-Təalanın məkanı deyildir)**. (يَهْد۪ي مَنْ يَشَٓاءُ اِلٰى صِرَاطٍ مُسْتَق۪يمٍ) - Allah-Təala kimi istəsə, düz və haqq olan yola hidayət edər. Heç kim Allah-Təalaya etiraz edə bilməz.**

وَكَذٰلِكَ جَعَلْنَاكُمْ اُمَّةً وَسَطًا لِتَكُونُوا شُهَدَآءَ عَلَى النَّاسِ وَيَكُونَ الرَّسُولُ عَلَيْكُمْ شَهِيدًاۜ وَمَا جَعَلْنَا
الْقِبْلَةَ الَّت۪ي كُنْتَ عَلَيْهَآ اِلَّا لِنَعْلَمَ مَنْ يَتَّبِعُ الرَّسُولَ مِمَّنْ يَنْقَلِبُ عَلٰى عَقِبَيْهِۜ

---

**143) (وَكَذٰلِكَ) - necə ki siz möminlərə hidayət edib Kəbəni hikmət üzrə sizdən ötrü qiblə təyin etdim, habelə (جَعَلْنَاكُمْ اُمَّةً وَسَطًا) - siz Hz. Məhəmməd ümmətini də bütün ümmətlərin içində seçilmiş ümmət etdim. (لِتَكُونُوا شُهَدَآءَ عَلَى النَّاسِ) – ta ki qiyamət günündə əvvəlki ümmətlərin zərərinə şahid olasınız.** (Qiyamət günündə əvvəlki ümmətlər peyğəmbərlərin onlara ehkam bildirməsini inkar edərlər. Allah-Təala da onlardan şahid istəyər, halbuki Allah-Təala özü agahdır ki, Hz. Məhəmmədin ümməti şahid gətirilib, peyğəmbərlərin ilahi ehkamı təbliğ etdiyinə şəhadət edərlər. Əvvəlki ümmətlər deyərlər: “Siz haradan bilirsiniz ki, peyğəmbərlər bizə ehkamı bildirib, halbuki siz bütün ümmətlərdən sonra gəlibsiniz”. Müsəlmanlar deyərlər: “Biz buna Allah-Təalanın xəbər verməsi ilə agah olmuşuq, Qurani-Şərifində bizə bildiribdir”). **(وَيَكُونَ الرَّسُولُ عَلَيْكُمْ شَهِيدًا) - o vaxt ki siz möminlər keçən ümmətlərə şəhadət etdiniz, uca peyğəmbər** (Hz. Məhəmməd (ə.s)) **sizin doğruluğunuza şahid olar.** (O zaman ki Hz. Məhəmmədin (ə.s) ümməti peyğəmbərlərin doğruluğuna şəhadət etdilər, peyğəmbərdən soruşular: “Bəs sənin ümmətin adil və sözlərində sadiqdirlərmi?” (Buxari, Təfsir, 2/13; Tirmizi, Təfsir, 2; İbn Macə, Zühd 34) Uca peyğəmbərimiz ümmətini pak* edib, onların ədalətinə şahidlik edir).

*(*Qeyd: Müsəlmanlar bu ayəyə baxıb fəxr etməsinlər, ayədəki ümmətdən məqsəd bu dövrdəki yalançı, fitnəkar, cahil, yalan sözləri yayan, Qurana zidd əməllər edən və islam ümməti arasında ixtilaf və nifaq salanlar deyildir. Əksinə, məqsəd islamın ilk dövründəki qeyrətli, din və ümmətinə sadiq, ittihad və ittifaqı sevib, Qurani-Şərifə bağlı olan səhabələrdir ki, əgər onlardan birinin imanını digər müsəlmanların imanıyla ölçsəydiniz, hər halda daha artıq olardı. Bu səhabələrdən məqsəd peyğəmbərimizin cənnətlə müjdələdiyi 10 nəfər və onlar kimi olanlardır (Tirmizi, Mənaqib, 99)).*

**(وَمَا جَعَلْنَا الْقِبْلَةَ الَّت۪ي كُنْتَ عَلَيْهَآ) - indi səndən ötrü əvvəkli qibləni** (Kəbəni) **qiblə təyin etmədik, (اِلَّا لِنَعْلَمَ مَنْ يَتَّبِعُ الرَّسُولَ مِمَّنْ يَنْقَلِبُ عَلٰى عَقِبَيْهِ)** – (ancaq ona görə təyin etdik ki,) **peyğəmbərə tabe olub imanında qalanı islamdan dönüb mürtəd olandan agah olub seçək. (Allah-Təalanın bu mübarək kəlamı - “Kəbəni qiblə təyin etdik, ta ki kim dinində qalıb sənə tabe olur və kim islamdan çıxır, ondan agah olaq”, - bizim adət-ənənə və istilahımıza görədir. Allah-Təala özünü bu məxluqata daxil edib buyurur: “Ey Məhəmməd, biz qibləni Kəbəyə doğru çevirdik ki, agah olaq. Yəni sizinlə birlikdə görək, bu işin aqibəti necə olur, görək insanlar Allah-Təala hökmünə tabe olub dinlərində qalırlar, yoxsa yox?” Necə ki bir şəxs bir işin aqibətinə agah olsa, məclisində olan şəxslərə deyər: biz filan əməli edirik, ta ki görək o**

وَاِنْ كَانَتْ لَكَبِيرَةً اِلَّا عَلَى الَّذِينَ هَدَى اللّٰهُ وَمَا كَانَ اللّٰهُ لِيُضِيعَ اِيمَانَكُمْ اِنَّ اللّٰهَ بِالنَّاسِ لَرَؤُفٌ رَحِيمٌ

﴿١٤٣﴾ قَدْ نَرٰى تَقَلُّبَ وَجْهِكَ فِي السَّمَاءِ فَلَنُوَلِّيَنَّكَ قِبْلَةً تَرْضٰيهَا فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ

---

**işin aqibəti necə olur? Halbuki o şəxs özü o işin aqibətinə agahdır, amma istəyir məclisində olan şəxslərə bildirsin ki, onlar da o işin aqibətini bilsinlər. Çünki ola bilərdi ki, özü onlara deyəndə, onlar qəbul etməsinlər və bu ayədə Allah-Təala onlara hörmət etdiyinə görə özünü peyğəmbərin və möminlərin qrupuna daxil etdi. (وَاِنْ كَانَتْ لَكَبِيرَةً) - həqiqətən, qibləni Beytül-müqəddəsdən Kəbəyə dəyişdirmək insanlara çox ağırdır. (اِلَّا عَلَى الَّذِينَ هَدَى اللّٰهُ) - ancaq o şəxslər ki Allah-Təala onlara hidayət edib və öz dinlərində sabit və bərqərar olublar, belə şəxslərə qibləni dəyişdirmək ağır və məşəqqətli olmaz. (وَمَا كَانَ اللّٰهُ لِيُضِيعَ اِيمَانَكُمْ) - Allah-Təala sizin imanınızda sabit olmağınızı zay edən deyil, əksinə, sizə böyük savab bəxş edəcəkdir. (اِنَّ اللّٰهَ بِالنَّاسِ لَرَؤُفٌ رَحِيمٌ) - həqiqətən, Allah-Təala məxluqata qarşı mehriban və rəhm edəndir. Heç vaxt onların əcr, savablarını zay etməz.** (Gələn ayədə Allah-Təala möhtərəm peyğəmbərinə buyurur ki, bundan sonra Kəbəyə yönəlin. Sənin və ümmətin üçün Kəbəni qiblə təyin etdim. Peyğəmbər Mədinəyə təşrif buyurandan sonra rəcəb ayının 15-ci günündə, bazar ertəsi günü əsr namazı vaxtı bu ayə nazil olub, peyğəmbər Kəbə tərəfinə yönəlməklə əmr olundu).

**144) (قَدْ نَرٰى تَقَلُّبَ وَجْهِكَ فِي السَّمَاءِ )** – (ey Məhəmməd)**, üzünü səmaya dolandırdığını çox görürük, guya bir işin intizarını çəkirsən, (peyğəmbər həmişə evindən çıxanda səmaya nəzər salıb, qiblə barəsində ona vəhy gəlməsini gözləyərdi. Necə ki Məkkədə olanda Kəbə ondan ötrü qiblə idi, yenə də Kəbənin qiblə olmasını istəyirdi. Peyğəmbərimiz bu arzuda idi, ta ki bu ayə nazil oldu). (فَلَنُوَلِّيَنَّكَ قِبْلَةً تَرْضٰيهَا)** – (ey Məhəmməd)**, Kəbənin qiblə olmasını bu qədər istədiyin üçün, əlbəttə, səni o qiblənin** (Kəbənin) **tərəfinə döndərərik ki, ona razı olasan. (فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ)- indi üzünü* Məscidül-harama tərəf döndər.**

*(***Qeyd:** Məscidül-haram, Kəbənin ətrafındakı bir yerdir. Kəbə Allah-Təalanın evi, Məscidül-haramın ortasındadır. Bu səbəbdən Allah-Təala buyurdu: üzünü Məscidül-harama tərəf döndər. Bir də Məkkədə olanlar gərək namaz vaxtı Kəbənin özünə yönəlsinlər. Amma başqa məkanlarda olan şəxs namaz qılanda Məscidül-harama yönəlsə, kifayət edər. Çünki kənar yerlərdə namaz qılanlardan ötrü eynən Kəbəyə yönəlmək müşkül işdir. Bəli, bu şəxslər gərək diqqət etsinlər ki, üzləri Məscidül-haramdan kənara baxmasın. Bu, iki elmlə mümkündür: biri astronomiya, o biri coğrafiya elmidir. Bu iki elmin təhsili müsəlmanlardan ötrü lazımdır. Lakin bu iki elmdən nəinki avam xalq, hətta islam üləması da bixəbərdir. O səbəbdən hər yerdə Cədyi (oğlaq bürcü), ya da kompasın cənubu göstərən oxunu qibləni təyin etmə vasitəsi sayırlar. Kompasın adını "qiblənüma" (qiblə göstərən) qoyub, Məkkəyə ge-*

وَحَيْثُ مَا كُنْتُمْ فَوَلُّوا وُجُوهَكُمْ شَطْرَهُ ۗ وَاِنَّ الَّذٖينَ اُوتُوا الْكِتَابَ لَيَعْلَمُونَ اَنَّهُ الْحَقُّ مِنْ رَبِّهِمْ ۗ وَمَا
اللّٰهُ بِغَافِلٍ عَمَّا يَعْمَلُونَ ﴿١٤٤﴾ وَلَئِنْ اَتَيْتَ الَّذٖينَ اُوتُوا الْكِتَابَ بِكُلِّ اٰيَةٍ مَا تَبِعُوا قِبْلَتَكَ ۚ وَمَٓا اَنْتَ
بِتَابِعٍ قِبْلَتَهُمْ ۚ وَمَا بَعْضُهُمْ بِتَابِعٍ قِبْلَةَ بَعْضٍ وَلَئِنِ اتَّبَعْتَ اَهْوَٓاءَهُمْ مِنْ بَعْدِ مَا جَٓاءَكَ مِنَ الْعِلْمِ اِنَّكَ
اِذًا لَمِنَ الظَّالِمٖينَ ۘ﴿١٤٥﴾ اَلَّذٖينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ يَعْرِفُونَهُ كَمَا يَعْرِفُونَ اَبْنَٓاءَهُمْ ۗ

---

*dib gələnlərin əksəri bunda ixtilaf edirlər. Yəni deyirlər: "Bu qiblənüma bizim yerdə qibləni göstərdiyi kimi, Məkkədə də bir fərq olmadan elə göstərir". Bəziləri də deyir: "Təəccüblüdür, qiblənüma Məkkədə fərqlilik göstərir". Görəsən, bu sözlərdən artıq cəhalət varmı? Bu söz təkcə avam xalqa məxsus olmayıb, elm əhli sayılanlardan da belə sözlər eşidilir. Bəli, cəhalət insanı həşərat kimi edər).*

**(وَحَيْثُ مَا كُنْتُمْ فَوَلُّوا وُجُوهَكُمْ شَطْرَهُ) - harda olsanız, namaz vaxtı üzünüzü Məscidül-haram tərəfinə döndərin. (وَاِنَّ الَّذٖينَ اُوتُوا الْكِتَابَ) - həqiqətən, o şəxslər ki onlara kitab** (Tövrat) **verilibdir, (لَيَعْلَمُونَ اَنَّهُ الْحَقُّ مِنْ رَبِّهِمْ) - əlbəttə, agahdırlar ki, bu qiblə dəyişikliyi onların rəbbi Allah-Təala tərəfindən bir haqdır. Hz. Məhəmməd (s.ə.s), öz arzusu ilə qibləni dəyişdirməyibdir. Bununla belə yenə inad edib, inkar edirlər. (وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا يَعْمَلُونَ) - o şeyləri ki yəhudilər edir, Allah-Təala onlardan qafil deyildir.**

**145) (وَلَئِنْ اَتَيْتَ الَّذٖينَ اُوتُوا الْكِتَابَ بِكُلِّ اٰيَةٍ) –** (ey Məhəmməd)**, əgər sən Kəbənin qiblə olması haqqında əhli-kitabdan ötrü nə qədər dəlil və bürhan gətirsən, (مَا تَبِعُوا قِبْلَتَكَ) - sənin qiblənə** (Kəbəyə), **tabe olan deyillər. (وَمَٓا اَنْتَ بِتَابِعٍ قِبْلَتَهُمْ) - sən də onların qibləsinə tabe olan deyilsən. (وَمَا بَعْضُهُمْ بِتَابِعٍ قِبْلَةَ بَعْضٍ) – əhli-kitabın bəzisi də digərlərinin qibləsinə tabe olan deyildir.** (Ey Məhəmməd, yəhudi və xristianlar hərçənd sənə müxalif olub, sənin qiblənə tabe olmurlar, lakin bir-biriləri ilə də müttəfiq olmayıb, bir-birilərinin qibləsinə tabe olmazlar). **(وَلَئِنِ اتَّبَعْتَ اَهْوَٓاءَهُمْ مِنْ بَعْدِ مَا جَٓاءَكَ مِنَ الْعِلْمِ) –** (ey Məhəmməd)**, əgər sənə Quran gələndən sonra yəhudi və xristianların istəyinə tabe olub, onların qibləsinə yönəlsən, (اِنَّكَ اِذًا لَمِنَ الظَّالِمٖينَ) - həqiqətən, sən o zaman zalımlardan olarsan.** (Bu ayə peyğəmbərə xitab olsa da, ayənin hökmü dəlil və sübutu tərk edib, nəfsani istəklərə tabe olanların hamısına şamildir. Necə ki bizim bu zəmanəmizdə Quranı tərk edib, öz arzularına tabe olub, ilahi ehkamları təhrif edib, dəyişdirib, onunla hərəkət edirlər).

**146) (اَلَّذٖينَ اٰتَيْنَاهُمُ الْكِتَابَ) - o şəxslər ki onlara kitab** (Tövrat) **vermişik, (يَعْرِفُونَهُ) –** (Məhəmmədi) **tanıyırlar,** (bilirlər ki, o, haqq olan peyğəmbərdir). **(كَمَا يَعْرِفُونَ اَبْنَٓاءَهُمْ) - necə ki öz oğullarını tanıyırlar.** (Ömər ibn Xəttab yəhudilərin böyük üləmasından olan Abdullah ibn Salamdan soruşdu ki, Hz. Məhəmmədin və onun peyğəmbər olması haqqında nə deyirsən? Abdullah ibn Salam dedi: "Mən onun peyğəmbər olmasına öz oğlumun, həqiqətən, oğlum olmasından daha çox agaham". Ömər dedi: "Niyə?" Abdullah cavab verdi:

وَاِنَّ فَرِيقًا مِنْهُمْ لَيَكْتُمُونَ الْحَقَّ وَهُمْ يَعْلَمُونَ ﴿١٤٦﴾ اَلْحَقُّ مِنْ رَبِّكَ فَلَا تَكُونَنَّ مِنَ الْمُمْتَرِينَ
﴿١٤٧﴾ وَلِكُلٍّ وِجْهَةٌ هُوَ مُوَلِّيهَا فَاسْتَبِقُوا الْخَيْرَاتِ اَيْنَ مَا تَكُونُوا يَاْتِ بِكُمُ اللّٰهُ جَمِيعًا اِنَّ اللّٰهَ عَلٰى
كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٤٨﴾ وَمِنْ حَيْثُ خَرَجْتَ فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ وَاِنَّهُ لَلْحَقُّ مِنْ
رَبِّكَ وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ ﴿١٤٩﴾ وَمِنْ حَيْثُ خَرَجْتَ فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ

---

"Çünki Tövratda onun xəbərini eşidib və xüsusiyyətlərini görmüşəm. Şəkkim yoxdur ki, Məhəmməd haqq olan peyğəmbərdir. Amma oğlum ola bilər ki, mənim deyil, anası mənə xəyanət etmiş ola bilər". Ömər durub Abdullahın başından öpdü). **(وَاِنَّ فَرِيقًا مِنْهُمْ لَيَكْتُمُونَ الْحَقَّ) - həqiqətən, əhli-kitabdan bir qrup haqqı** (Hz. Məhəmmədin haqq peyğəmbər olmasını) **gizlədirlər. (وَهُمْ يَعْلَمُونَ) - halbuki özləri haqqı gizlətmənin əzabına agahdırlar.**

**147) (اَلْحَقُّ مِنْ رَبِّكَ) –** (ey Məhəmməd)**, sənin bu peyğəmbərlik işin rəbbin Allah-Təala tərəfindən olan bir haqdır. (فَلَا تَكُونَنَّ مِنَ الْمُمْتَرِينَ) - əlbəttə, sən öz işində şəkk edənlərdən olma.** (Yəhudilər həmişə arzu edirdilər ki, peyğəmbər öz dediyi sözü dəyişdirsin, ya da onlara kömək etsin. Allah-Təala bu ayədə onların ümidini kəsir. Yəni peyğəmbərin öz dediyi sözlərinə şəkki olmadığından öz işində sabit və möhkəmdir).

**148) ( وَلِكُلٍّ وِجْهَةٌ ) - hər bir din və məzhəb əhlindən ötrü bir yön vardır. (هُوَ مُوَلِّيهَا) - o din və məzhəb əhli ibadət vaxtı o tərəfə yönələrlər. (Yəni hər bir din əhli özlərindən ötrü bir yönü qiblə təyin ediblər və o tərəfə yönəlirlər. Amma hamısından xeyirlisi və yaxşısı Kəbəyə yönəlməkdir). (فَاسْتَبِقُوا الْخَيْرَاتِ) - ey müsəlmanlar, hər bir xeyir əməldə qabağa gedin və bu xeyir əməllərdən biri də Kəbəyə yönəlməkdir. Necə ki əmr olunubsunuz, ibadət vaxtı Kəbəyə yönəlin. (اَيْنَ مَا تَكُونُوا) - harda olsanız və hara yönəlsəniz də, (يَاْتِ بِكُمُ اللّٰهُ جَمِيعًا) - Allah-Təala qiyamət günündə hamınızı gətirib bir məkana toplayıb, öz əməllərinizin qarşılığını sizə verəcəkdir. (اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) - həqiqətən, Allah-Təala hər bir şeyə qadirdir.** (O cümlədən sizi bir məkana toplayıb, əməllərinizin cəzasını sizə verəcək)**.**

**149) (وَمِنْ حَيْثُ خَرَجْتَ) –** (ey Məhəmməd)**, səfər üçün haradan çıxsan, (فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ) - üzünü** (namaz vaxtı) **Məscidül-haram tərəfinə döndər, (وَاِنَّهُ لَلْحَقُّ مِنْ رَبِّكَ) - və bu, əlbəttə sənə tərbiyə verən rəbbin Allah-Təala tərəfindən bir haqdır, (وَمَا اللّٰهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ) – etdiyiniz şeylərdən Allah-Təala qafil olmayıb hər bir əməlinizə agahdır.** (Növbəti ayədə 3-cü dəfə təkidlə buyurur ki, harda olsanız, gərək ibadət vaxtı Kəbəyə yönələsiniz).

**150) (وَمِنْ حَيْثُ خَرَجْتَ) -** (ey Məhəmməd)**, səfər üçün haradan çıxsan, (فَوَلِّ وَجْهَكَ شَطْرَ الْمَسْجِدِ الْحَرَامِ) - üzünü** (namaz vaxtı) **Məscidül-haram**

وَحَيْثُ مَا كُنْتُمْ فَوَلُّوا وُجُوهَكُمْ شَطْرَهُ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَيْكُمْ حُجَّةٌ اِلَّا الَّذِينَ ظَلَمُوا مِنْهُمْ فَلَا
تَخْشَوْهُمْ وَاخْشَوْنِي وَلِاُتِمَّ نِعْمَتِي عَلَيْكُمْ وَلَعَلَّكُمْ تَهْتَدُونَ ﴿١٥٠﴾ كَمَآ اَرْسَلْنَا فِيكُمْ رَسُولًا مِنْكُمْ
يَتْلُوا عَلَيْكُمْ اٰيَاتِنَا وَيُزَكِّيكُمْ وَيُعَلِّمُكُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَيُعَلِّمُكُمْ مَا لَمْ تَكُونُوا تَعْلَمُونَ ﴿١٥١﴾

---

**tərəfinə döndər, (وَحَيْثُ مَا كُنْتُمْ)** – (ey möminlər), **harda olsanız, (فَوَلُّوا وُجُوهَكُمْ شَطْرَهُ) - ibadət vaxtı üzünüzü Məscidül-haram tərəfinə döndərin. (لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَيْكُمْ حُجَّةٌ) – bu, ondan ötrüdür ki, yəhudi camaatı tərəfindən sizin zərərinizə bir dəlil və sübut olmasın.** (Yəhudi camaatı deyirdi: "Əgər bu peyğəmbərdirsə, gərək, babası İbrahimin qibləsinə doğru namaz qılsın. İndi ki siz müsəlmanlar namaz vaxtı Kəbəyə yönəldiniz, daha yəhudilər sizə irad tuta bilməzlər"). **(اِلَّا الَّذِينَ ظَلَمُوا مِنْهُمْ) - ancaq yəhudilərdən zalım və inadkar olanlar deyirlər: (bizim qibləni tərk edib ona görə Kəbəyə meyil etdi ki, öz qövmünün dinini** (müşrik olmağı) **sevib, onların dininə meyil edir. Bu sözü yəhudi camaatından inadkar və zalım olanlar dedilər. İnadkar şəxsin sözünə heç vaxt etibar yoxdur. Necə ola bilər ki, peyğəmbər müşriklərin dinini sevsin, əgər sevsəydi, onu Məkkədən qovmazdılar. Amma yəhudilərin əksəriyyəti belə deyirdi: "Əgər bu peyğəmbər olsa idi, gərək, babası İbrahimin qibləsinə doğru namaz qılaydı, çünki Tövratda belə əmr olunubdur"). (فَلَا تَخْشَوْهُمْ) - qibləyə tənə edən inadkar və zalımlardan qorxmayın. (وَاخْشَوْنِي) - məndən qorxub, mənim əmr və itaətimdən çıxmayın. (وَلِاُتِمَّ نِعْمَتِي عَلَيْكُمْ) - sizə olan nemətlərimi tamamlamaqdan ötrü sizə Məscidül-harama yönəlməyi əmr etdim. Ta ki ibadət vaxtı Məscidül-harama yönəlib, islamda möhkəm olasınız.** (Hz. Əli (ə.s) buyurub: "Allah-Təalanın nemətinin insana tamam olması odur ki, müsəlman olaraq dünyadan getsin" (Tirmizi, Dua 93; Əhməd b. Hənbəl, Müsnəd, V)). **(وَلَعَلَّكُمْ تَهْتَدُونَ) - əlbəttə siz Məscidül-hərama yönəlmək səbəbinə gərək hidayət tapanlardan olasınız.** (Allah-Təalanın əmrinə tabe olan şəxs, əlbəttə, hidayət tapar).

**151) (كَمَآ اَرْسَلْنَا فِيكُمْ رَسُولًا مِنْكُمْ) - nemətlərimi sizə tamam edib, necə ki siz ərəblərin içindən sizə bir peyğəmbər** (Məhəmməd) **göndərdim,** (bu, siz ərəblərdən ötrü bir iftixardır ki, sizin öz içinizdən sizə peyğəmbər göndərdim), **(يَتْلُوا عَلَيْكُمْ اٰيَاتِنَا) – ta ki o peyğəmbər bizim ayələrimizi sizə oxusun. (وَيُزَكِّيكُمْ) - sizi bütpərəst və müşrik olmaqdan pak və təmiz etsin,** (وَيُعَلِّمُكُمُ الْكِتَابَ وَالْحِكْمَةَ) **Qurani-Şərifin əhkamını və hikmətini** (maarifi-ilahiyyəni) **sizə təlim etsin. (وَيُعَلِّمُكُمْ مَا لَمْ تَكُونُوا تَعْلَمُونَ) - və sizə bilmədiyiniz şeyləri təlim* etsin.** (Keçən peyğəmbərlərin əhvalatından, gələcəkdə vaqe olacaq bəzi xəbərlərdən, insanı həqiqətən insan edən gözəl xüsusiyyətlərdən sizə bəhs edib öyrətsin).

*(*Qeyd: Həqiqətən, uca peyğəmbərimiz gözəl xüsusiyyətlərdə və üstün əxlaqda yeganə olub, sahib olduğu bütün gözəl xüsusiyyətlərin hamısını ümmətinə öyrədib və*

فَاذْكُرُونِيٓ اَذْكُرْكُمْ وَاشْكُرُوا لِي وَلَا تَكْفُرُونِ ﴿١٥٢﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا اسْتَعِينُوا بِالصَّبْرِ
وَالصَّلٰوةِ اِنَّ اللّٰهَ مَعَ الصَّابِرِينَ ﴿١٥٣﴾

---

*əmr edibdir ki, gərək o xüsusiyyətlərə onlar da sahib olsunlar və onların ziddindən çəkinsinlər. Elmi, mülayimliyi, təvazökarlığı əmr edib, zülm edən şəxsə güzəşt etməyi, qohum-əqrəba ziyarətini, səxavətli olmağı, yoxsullara yardım etməyi, möminləri sevindirməyi, birlik içində olmağı, qardaşlıq içində yaşamağı, yardımsevərliyi və bir çox başqa gözəl xüsusiyyətləri də əmr edib, saymaqla qurtaran deyil. Bunların əksini qadağan edibdir. Əgər peyğəmbərin bütün hədislərindəki mənalardan xəbərdar olsaq, heyrətlər içində qalarıq. Təhsilsiz bir şəxsdə bu qədər elm olarmı? O elmlərin Allah-Təaladan olduğunu deməkdən başqa, heç bir söz layiq deyildir, amma islam ümməti o həzrətin əmr və qadağalarını, nəsihət və qanunlarını, vəsiyyətlərini bir kənara atıb, onların əksinə yönəlibdir. İnsafla baxsaq, Qurani-Şərifin ehkamı islam ümməti arasında hökmsüz qalıb, islamın həqiqətləri onların arasından qeyb olub, başqa bir din və məzhəb ixtira olunubdur. Qurani-Şərifin ehkamından üz döndərmək müsəlmanların geri qalmasına bais olubdur).*

**152) (فَاذْكُرُونِيٓ) - necə ki mən sizi yada salıb, sizə peyğəmbər göndərdim, siz də məni yada salıb, mənə itaət edin. (اَذْكُرْكُمْ) - o vaxt mən də sizi yada salıb, sizə mükafat verərəm. (وَاشْكُرُوا لِي وَلَا تَكْفُرُونِ) - mənim nemətlərimə şükür edib, kafir olmayın.**

**153) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا) - ey iman gətirən şəxslər, (اسْتَعِينُوا) - dünya və axirət işlərinizdə Allah-Təaladan kömək istəyin. (بِالصَّبْرِ وَالصَّلٰوةِ) - iki şeylə, biri səbir, o birisi namaz. (İnsanda mütləq gərək səbir olsun. Əgər insan dünya və axirətin şiddət və məşəqqətlərinə səbir etməsə, dünya və axirətin ləzzətlərinə qovuşa bilməz və Allah-Təalaya itaət və bəndəlik baxımından namazda digər ibadətlərdən daha çox dəlil vardır. Namazda səcdə etmək ən böyük ibadət olduğundan namaz ibadətlərdən üstün sayıldı. Səcdədə ən şərəfli əza olan üzün hər bir şeydən əskik hesab olunan torpağa qoyulması möminin mütləq qüdrət sahibi olan Allah-Təaladan qorxusuna və təqvasına işarə edib, səcdə edən şəxsin Allaha yaxınlaşmasına səbəb olar. (اِنَّ اللّٰهَ مَعَ الصَّابِرِينَ) - həqiqətən, Allah-Təala səbir edən şəxslərlə bir olub, onları sevib, onlara kömək edər.**

(Növbəti ayə Bədir savaşında şəhid olanlar haqqında nazil olubdur. Bədir Məkkə ilə Mədinə arasında bir yerin adıdır. Orada müsəlmanlarla məkkəli müşriklərin arasında savaş oldu. O savaşda müsəlmanlar qalib gəldilər. O savaş islamda ilk savaşdır. İnşallah, Bədir savaşının qissəsi haqda Ənfal surəsində bəhs olunacaqdır. Müsəlmanlardan 14 nəfər o savaşda şəhidliyə qovuşdu. O 14 nəfərin qanlarının tökülməsi islamın ucalmasına səbəb oldu. Bərəkətli olduğu üçün o həzrətlərin adlarını burada qeyd edirəm. Gərək müsəlmanlar

وَلَا تَقُولُوا لِمَنْ يُقْتَلُ فِي سَبِيلِ اللّٰهِ اَمْوَاتٌ بَلْ اَحْيَآءٌ وَلٰكِنْ لَا تَشْعُرُونَ﴿١٥٤﴾ وَلَنَبْلُوَنَّكُمْ بِشَيْءٍ
مِنَ الْخَوْفِ وَالْجُوعِ وَنَقْصٍ مِنَ الْاَمْوَالِ وَالْاَنْفُسِ وَالثَّمَرَاتِ وَبَشِّرِ الصَّابِرِينَ﴿١٥٥﴾

---

həmişə o şəxsləri xatırlayıb, o günləri unutmasınlar. O şəhidlərin altısı mühacir*, səkkizi ənsardan idi.**

*(*__Qeyd:__ Peyğəmbərlə birlikdə, Məkkədən Mədinəyə hicrət edən Məkkə əhlinə mühacir deyilir).*

*(**__Qeyd:__ Mədinədə peyğəmbərə kömək edib, islamı qəbul edib yayan Mədinə əhlinə ənsar deyilir).*

6 nəfər mühacir bunlardır: 1. Übeydə ibn Haris ibn Əbdülmüttəlib, peyğəmbərin əmisi oğludur. Bu şəxs din və ümmət yolunda ilk şəhid olan şəxsdir. 2. Ümeyr ibn Əbu Vəqqas, 3. Ümeyr ibn Əbdi Əmr, ləqəbi Züş-şimaleyndir. 4. Aqil ibn Əbu Bəkir, 5. Mihca-Ömər ibn Xəttabın qulamı, 6. Səfvan ibn Beyza, Beyza Əbdülmüttəlibin qızıdır, kamil və məşhur bir qadın olduğundan Səfvan anasının adıyla məşhur idi. Ənsardan şəhid olan səkkiz nəfər bunlardır: 1. Sə`d ibn Xeysəmə, 2. Mübəşşir ibn Əbdülmünzir. 3. Yezid ibnül-Haris, 4. Ümeyr ibn Həmmam, 5. Rafi ibn əl-Müəlla, 6. Harisə ibn Süraqə, 7- 8. Harisin iki oğlu: Əvf və Müəvviz. Allah hamısından razı olsun. Bu qeyd olunan şəxslər şəhid olandan sonra bəzi müsəlmanlar dedilər: “Heyf ki, onlar ölüb dünyadan getdilər. Dünya ləzzətindən məhrum oldular”. Allah-Təala növbəti ayədə onların bu kəlamını rədd edib buyurur:)

**154) (وَلَا تَقُولُوا لِمَنْ يُقْتَلُ فِي سَبِيلِ اللّٰهِ اَمْوَاتٌ) - o şəxslər ki Allah-Təala yolunda şəhid olublar, onlara ölü, dünya ləzzətindən binəsib deməyin. (بَلْ اَحْيَآءٌ) - əksinə, onlar diridirlər. Allah-Təala yanında onlardan ötrü yaxşı, ləzzətli nemətlər vardır. (وَلٰكِنْ لَا تَشْعُرُونَ) - lakin sizdə o şüur və idrak yoxdur ki, onların halına və həyatlarına agah olasınız.**

**155) (وَلَنَبْلُوَنَّكُمْ بِشَيْءٍ مِنَ الْخَوْفِ وَالْجُوعِ) - ey möminlər, əlbəttə, mən sizi imtahan edib, bir az qorxu və aclığa mübtəla edərəm. (وَنَقْصٍ مِنَ الْاَمْوَالِ وَالْاَنْفُسِ وَالثَّمَرَاتِ)- sizi malınızdan və nəfsinizdən və meyvələrinizdən naqis və əskik olmağa düçar edərəm.** (Ta ki Allah-Təalanın qəza və qədərinə səbir edib etməyənlər sizin özünüzə məlum olsun). **(وَبَشِّرِ الصَّابِرِينَ)** – (ey Məhəmməd)**, bu müsibətlərə səbir edən şəxsləri axirətdə nicat tapmaqla müjdələ.** (Müəllif deyir: “Allah-Təala bizi bu günlərdə qış fəslində bir böyük qorxuya düçar edib. Hərçənd bu, Allah-Təala yanında az və kiçik hesab olunan qorxudur. Necə ki özü buyurur. Amma bizdən ötrü çox böyük bir hadisədir. H. 1319-cu il, Zülqədə ayının dördü, cümə axşamı günü zöhr namazından bir saat sonra bir zəlzələ vaqe oldu. Hərçənd bizim sakin olduğumuz Bakı şəhərində çox şiddətlə hiss edilməsə də, şiddətli qorxudan xalq çaşqın və narahat oldu.

اَلَّذينَ اِذَٓا اَصَابَتْهُمْ مُصِيبَةٌۙ قَالُوٓا اِنَّا لِلّٰهِ وَاِنَّٓا اِلَيْهِ رَاجِعُونَۜ ﴿١٥٦﴾ اُولٰٓئِكَ عَلَيْهِمْ صَلَوَاتٌ مِنْ رَبِّهِمْ وَرَحْمَةٌ وَاُولٰٓئِكَ هُمُ الْمُهْتَدُونَ ﴿١٥٧﴾ اِنَّ الصَّفَا وَالْمَرْوَةَ مِنْ شَعَٓائِرِ اللّٰهِۚ فَمَنْ حَجَّ الْبَيْتَ اَوِ اعْتَمَرَ فَلَا جُنَاحَ عَلَيْهِ اَنْ يَطَّوَّفَ بِهِمَاۜ وَمَنْ تَطَوَّعَ خَيْرًاۙ فَاِنَّ اللّٰهَ شَاكِرٌ عَلِيمٌ ﴿١٥٨﴾

---

Həmin ayın səkkizi, bazar ertəsi günü zəlzələnin şiddətindən əzəmətli Şamaxı şəhəri darmadağın olub, bir divar da salamat qalmadı. Əhali bütünlüklə paltarsız, dəhşət içində biyabanda qaldı. Bir tərəfdən soyuğun şiddəti, bir tərəfdən qar yağır, o biri tərəfdən yanğınlar törəyib, hələ də ölülər daş-torpaq altında qalıbdır. Allahın qəzəb və əzabından Özünə sığınıram. Qeyd olunan bəla ayəni təsdiq edir”).

**156) (اَلَّذينَ اِذَٓا اَصَابَتْهُمْ مُصِيبَةٌ) - o şəxslərə ki bu qeyd olunan müsibətlərdən bir müsibət yetişdi, (قَالُوٓا) - o vaxt dedilər: (اِنَّا لِلّٰهِ وَاِنَّٓا اِلَيْهِ رَاجِعُونَ) - həqiqətən, biz Allah-Təalanın qüdrətinə tabe olub, Allah-Təala bizim özümüzə və ixtiyarımızda olan şeylərə malikdir, həqiqətən, ölüm bizə gələndən sonra Allah-Təalanın tərəfinə qayıdacağıq.**

**157) (اُولٰٓئِكَ عَلَيْهِمْ صَلَوَاتٌ مِنْ رَبِّهِمْ وَرَحْمَةٌ) - o şəxslər ki müsibətə səbir edib, yuxarıda qeyd edilən bu kəlamı deyir, onlara öz rəbləri Allah-Təala tərəfindən “sələvat”** (xeyir-dua) **və rəhmət yetişər. (وَاُولٰٓئِكَ هُمُ الْمُهْتَدُونَ) - və onlardır haqq yoluna hidayət tapıb sabit olanlar.** (Əvvəlki ayələrdə qiblə hökmünü bəyan edəndən sonra bir neçə ayədə də bəzi hökmləri bəyan edib, sıradakı ayədə Məkkədə Məscidül-həram və Kəbədən başqa bəzi şərəfli məkanları bəyan edir).

**158) (اِنَّ الصَّفَا وَالْمَرْوَةَ مِنْ شَعَٓائِرِ اللّٰهِ) - həqiqətən, Səfa* ilə Mərvə Allah-Təalaya ibadət olunan məkanların əlamətlərindəndir.**

*(*__Qeyd:__ Səfa və Mərvə iki kiçik təpədir ki, indi onların ətrafı və yuxarısı tamamən abadlaşdırılıb, o təpələrin hər ikisi hacıların onların arasında tavaf edib Allah-Təalanı zikr etməsi üçün bir əlamətdir).*

**(فَمَنْ حَجَّ الْبَيْتَ اَوِ اعْتَمَرَ) - kim ki həcc və ya ümrədən ötrü Kəbəni ziyarət üçün Məkkəyə daxil olsa, (bu, iki qisimdir: biri həcc, o biri ümrədir. Ümrədən ötrü Məkkəyə daxil olanda Məkkədən kənar “miqat”lar vardır. Orada ehram bağlanır, amma həccdən ötrü Məkkənin özündə ehram bağlanıb Mina və Ərəfata çıxarlar. Bunların təfsilatı həmin surənin bundan sonra gələn 196-cı ayəsinin təfsirində qeyd olunacaqdır. (فَلَا جُنَاحَ عَلَيْهِ اَنْ يَطَّوَّفَ بِهِمَا) - Səfa ilə Mərvə arasında tavaf etməkdə heç kimə bir günah yoxdur. Əksinə, onda böyük savab vardır. (وَمَنْ تَطَوَّعَ خَيْرًا) – kim ki vacib olandan daha artıq xeyir əməl etsə, (فَاِنَّ اللّٰهَ شَاكِرٌ عَلِيمٌ) - həqiqətən, Allah-Təala o xeyir əməli artırıb, ona artıq mükafat verəndir. Hər bir şəxsin qəlbinə agahdır**

اِنَّ الَّذ۪ينَ يَكْتُمُونَ مَٓا اَنْزَلْنَا مِنَ الْبَيِّنَاتِ وَالْهُدٰى مِنْ بَعْدِ مَا بَيَّنَّاهُ لِلنَّاسِ فِي الْكِتَابِۙ اُو۬لٰٓئِكَ يَلْعَنُهُمُ
اللّٰهُ وَيَلْعَنُهُمُ اللَّاعِنُونَۙ ﴿١٥٩﴾ اِلَّا الَّذ۪ينَ تَابُوا وَاَصْلَحُوا وَبَيَّنُوا فَاُو۬لٰٓئِكَ اَتُوبُ عَلَيْهِمْۚ وَاَنَا التَّوَّابُ
الرَّح۪يمُ ﴿١٦٠﴾ اِنَّ الَّذ۪ينَ كَفَرُوا وَمَاتُوا وَهُمْ كُفَّارٌ اُو۬لٰٓئِكَ عَلَيْهِمْ لَعْنَةُ اللّٰهِ وَالْمَلٰٓئِكَةِ وَالنَّاسِ اَجْمَع۪ينَۙ
﴿١٦١﴾ خَالِد۪ينَ ف۪يهَاۚ لَا يُخَفَّفُ عَنْهُمُ الْعَذَابُ وَلَا هُمْ يُنْظَرُونَ ﴿١٦٢﴾ وَاِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌۚ لَٓا اِلٰهَ
اِلَّا هُوَ الرَّحْمٰنُ الرَّح۪يمُ۟ ﴿١٦٣﴾ اِنَّ ف۪ي خَلْقِ السَّمٰوَاتِ وَالْاَرْضِ وَاخْتِلَافِ الَّيْلِ وَالنَّهَارِ

---

**ki, o xeyir əməl Allah-Təaladan ötrü edilib, yoxsa o əməlində riya var.** (Səfa ilə Mərvə arasında tavaf etmək və 7 dəfə gedib-gəlmək üləmaya görə həccin vacib əməllərindəndir. (Təbərsi, I/441) Amma ayənin zahiri onun vacib olduğuna işarə etmir, bu vaciblik rəvayətlərlə sabit olubdur)**. Bundan sonra gələn bir neçə ayə yəhudi üləması barəsində nazil olubdur.**

**159) (اِنَّ الَّذ۪ينَ يَكْتُمُونَ مَٓا اَنْزَلْنَا مِنَ الْبَيِّنَاتِ وَالْهُدٰى) - həqiqətən, yəhudi alimlərindən o şəxslər ki Hz. Məhəmmədin haqqında bizim Tövratda nazil etdiyimiz açıq-aşkar olan dəlillərimizi və haqq tərəfinə hidayət edən kəlamlarımızı gizlədib bəyan etmir, (مِنْ بَعْدِ مَا بَيَّنَّاهُ لِلنَّاسِ فِي الْكِتَابِ) - o dəlilləri xalqdan ötrü Tövratda biz bəyan və aşkar edəndən sonra gizlədib bəyan etmirlər. (اُو۬لٰٓئِكَ يَلْعَنُهُمُ اللّٰهُ وَيَلْعَنُهُمُ اللَّاعِنُونَ) - o gizlədənlərə Allah-Təala və möminlər lənət edirlər.** (Yəni Allah-Təalanın və möminlərin lənəti onlara olsun)**.**

**160) (اِلَّا الَّذ۪ينَ تَابُوا وَاَصْلَحُوا وَبَيَّنُوا) – bu qeyd olunan yəhudilərə lənət vardır, ancaq o şəxslər ki tövbə edib, fəsad əməllərini islah edib, Allah-Təalanın Tövratda xəbər verdiyi sözləri gizlətməyib xalq üçün bəyan edir, (فَاُو۬لٰٓئِكَ اَتُوبُ عَلَيْهِمْ) - o tövbə edənlərin tövbəsini qəbul edərəm. (وَاَنَا التَّوَّابُ الرَّح۪يمُ) - tövbəni qəbul edib xalqa rəhm edən mənəm, məndən başqası deyildir.**

**161) (اِنَّ الَّذ۪ينَ كَفَرُوا) - yəhudi üləmasından o şəxslər ki kafir olub** (Hz. Məhəmmədin) **peyğəmbərliyini gizlədirlər, (وَمَاتُوا وَهُمْ كُفَّارٌ) – və kafir olaraq ölüblər, (اُو۬لٰٓئِكَ عَلَيْهِمْ لَعْنَةُ اللّٰهِ وَالْمَلٰٓئِكَةِ وَالنَّاسِ اَجْمَع۪ينَ) - Allah-Təalanın, mələklərin və bütün məxluqatın lənəti o kafir yəhudilərin üzərinə olsun.**

**162) (خَالِد۪ينَ ف۪يهَا) - o kafirlər Allah-Təalanın lənəti içində həmişə qalarlar. (لَا يُخَفَّفُ عَنْهُمُ الْعَذَابُ) - Allah-Təalanın əzabı onlardan yüngülləşdirilməz. (وَلَا هُمْ يُنْظَرُونَ) - və o əzabda onlara möhlət də verilməz.**

**163) (وَاِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ لَٓا اِلٰهَ اِلَّا هُوَ الرَّحْمٰنُ الرَّح۪يمُ) - siz insanların məbudu bir olan Allah-Təaladır. Allah-Təaladan başqa, heç bir haqq olan məbud yoxdur. Həm dünyada, həm də axirətdə xalqa rəhm edən Allah-Təaladır. Bəs nədən ötrü Allah-Təalanın kitabı olan Qurana iman gətirməyib inkar edirsiniz?**

**164) (اِنَّ ف۪ي خَلْقِ السَّمٰوَاتِ وَالْاَرْضِ وَاخْتِلَافِ الَّيْلِ وَالنَّهَارِ) - həqiqətən, səmaların və yerin yaradılmasında, gecə və gündüzün bir-birinin dalınca gedib gəlmə-**

وَالْفُلْكِ الَّتِي تَجْرِي فِي الْبَحْرِ بِمَا يَنْفَعُ النَّاسَ وَمَآ اَنْزَلَ اللّٰهُ مِنَ السَّمَآءِ مِنْ مَآءٍ فَاَحْيَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَا وَبَثَّ فِيهَا مِنْ كُلِّ دَآبَّةٍ وَتَصْرِيفِ الرِّيَاحِ وَالسَّحَابِ الْمُسَخَّرِ بَيْنَ السَّمَآءِ وَالْاَرْضِ لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ ﴿١٦٤﴾ وَمِنَ النَّاسِ مَنْ يَتَّخِذُ مِنْ دُونِ اللّٰهِ اَنْدَادًا يُحِبُّونَهُمْ كَحُبِّ اللّٰهِ وَالَّذِينَ اٰمَنُوٓا اَشَدُّ حُبًّا لِلّٰهِ

---

**sində, (**وَالْفُلْكِ الَّتِي تَجْرِي فِي الْبَحْرِ بِمَا يَنْفَعُ النَّاسَ**) - xalqa mənfəət vermək üçün dənizdə üzüb gedən gəmilərdə, (**وَمَآ اَنْزَلَ اللّٰهُ مِنَ السَّمَآءِ مِنْ مَآءٍ**) - Allah-Təalanın səmadan endirdiyi şirin sularda, (**فَاَحْيَا بِهِ الْاَرْضَ بَعْدَ مَوْتِهَا**) – hansı ki o suyu endirəndən sonra onun səbəbinə yer üzünü dirildib yaşıllaşdırır və şadlandırır,** (yəni yer üzü quruyandan sonra Allah-Təala yağış göndərməklə yenidən onu yaşıllaşdırır)**. Həqiqətən, bu əzəmətli yer üzündə növbənöv bitkilər və çiçəklər bitir. Elə ki bahar fəsli oldu, Allah-Təalanın izni ilə əzəmətli yer üzü gizli qüvvəsini zahir edib, rəngarəng güllər öz Xaliqinin mükəmməl qüdrəti ilə torpaqdan baş qaldırıb, sanki, dilləri ilə bütün varlıqlarla birlikdə həmd-səna edərlər. Və heç kim bu sirdən tam xəbərdar deyildir. Ancaq hər kəs öz zənni ilə bir şeylər deyib danışır. Nə gözəl demiş Hakim Qaani: "Bahar fəslində doğru sözü heç kəs deməz" (**وَبَثَّ فِيهَا مِنْ كُلِّ دَآبَّةٍ**) - o suyun səbəbinə hər bir növ heyvanı yer üzündə çoxaldıb yaydı. (**وَتَصْرِيفِ الرِّيَاحِ**) - bir də rüzgarların hərəkət etməsində, (**وَالسَّحَابِ الْمُسَخَّرِ بَيْنَ السَّمَآءِ وَالْاَرْضِ**) - Allah-Təalanın qüdrətinə tabe olan səma ilə yer arasındakı buludlarda, (**لَاٰيَاتٍ لِقَوْمٍ يَعْقِلُونَ**) - bu qeyd olunan şeylərin hamısında aqil olub ağılla hərəkət edən şəxslərdən ötrü Allah-Təalanın tövhid və qüdrətinə açıq-aşkar dəlil və sübutlar vardır.** (Hz. Peyğəmbər buyurdu: "Allahın əzabı o şəxsə olsun ki, bu ayəni oxuyub təfəkkür etmir" (İbn Hibban, II/386)).

**165) (**وَمِنَ النَّاسِ مَنْ يَتَّخِذُ مِنْ دُونِ اللّٰهِ اَنْدَادًا**) - insanlardan bəziləri vardır ki, Allah-Təaladan başqa, məbudlar seçib, onları Allah-Təalaya zidd və şərik sayarlar. (**يُحِبُّونَهُمْ كَحُبِّ اللّٰهِ**) - Allah-Təalanı sevib təzim edər kimi, o bütləri də sevib onlara təzim edərlər.** (Allah-Təala ilə bütləri məhəbbət və təzimdə bərabər tutub eyni sayarlar). **(**وَالَّذِينَ اٰمَنُوٓا اَشَدُّ حُبًّا لِلّٰهِ**) - amma o şəxslər ki Allah-Təalaya və Hz. Məhəmmədə (ə.s), iman gətiriblər, onların Allah-Təalaya məhəbbəti və təzimi müşriklərin bütlərə olan məhəbbətlərindən daha artıq və möhkəmdir.** (Möminlər heç vaxt Allah-Təaladan üz döndərib, bütlərə sitayiş etmədilər. Amma müşriklər bəla-müsibət vaxtı bütlərdən* üz döndərib, Allah-Təalaya yönəlirdilər).

*(*****Qeyd:** Bütpərəstlər deyirdilər: bütlər bizimlə Allah-Təalanın arasında vasitədir. Bunlara ibadət edirik ki, bizi Allah-Təalaya yaxınlaşdırsınlar. Ya da qiyamət günündə bizdən ötrü Allah-Təalanın yanında şəfaət etsinlər. Bütpərəstlərin bəzisi bir müddət bir bütə sitayiş edib, bir müddət sonra o bütü tərk edib başqa bir bütə yönələrdi. Necə ki ərəblərdən Bahilə qəbiləsi aclığa düçar olanda bütlərini satıb, yemək alıb yemişdilər).*

وَلَوْ يَرَى الَّذِينَ ظَلَمُوٓا اِذْ يَرَوْنَ الْعَذَابَۙ اَنَّ الْقُوَّةَ لِلّٰهِ جَمِيعًاۙ وَاَنَّ اللّٰهَ شَدِيدُ الْعَذَابِ ﴿١٦٥﴾ اِذْ تَبَرَّاَ
الَّذِينَ اتُّبِعُوا مِنَ الَّذِينَ اتَّبَعُوا وَرَاَوُا الْعَذَابَ وَتَقَطَّعَتْ بِهِمُ الْاَسْبَابُ ﴿١٦٦﴾ وَقَالَ الَّذِينَ اتَّبَعُوا لَوْ
اَنَّ لَنَا كَرَّةً فَنَتَبَرَّاَ مِنْهُمْ كَمَا تَبَرَّؤُا مِنَّاۜ كَذٰلِكَ يُرِيهِمُ اللّٰهُ اَعْمَالَهُمْ حَسَرَاتٍ عَلَيْهِمْۜ وَمَا هُمْ بِخَارِجِينَ
مِنَ النَّارِ ﴿١٦٧﴾ يَٓا اَيُّهَا النَّاسُ كُلُوا مِمَّا فِي الْاَرْضِ حَلَالًا طَيِّبًاۘ وَلَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِۜ اِنَّهُ
لَكُمْ عَدُوٌّ مُبِينٌ ﴿١٦٨﴾ اِنَّمَا يَاْمُرُكُمْ بِالسُّٓوءِ وَالْفَحْشَٓاءِ وَاَنْ تَقُولُوا عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ ﴿١٦٩﴾

---

**(وَلَوْ يَرَى الَّذِينَ ظَلَمُوٓا اِذْ يَرَوْنَ الْعَذَابَ اَنَّ الْقُوَّةَ لِلّٰهِ جَمِيعًا وَاَنَّ اللّٰهَ شَدِيدُ الْعَذَابِ) – kaş zalım şəxslər qiyamət günündə Allah-Təalanın əzabını görəndə agah olaydılar ki,** (əlbəttə, agah olacaqlar ki,) **qüvvət və qüdrətin hamısı Allah-Təalaya məxsusdur və Allah-Təalanın əzabı şiddətli və möhkəmdir. O vaxt agah olacaqlar, dünyada Allah-Təalaya asi olduqları üçün peşman olacaqlar və o peşmanlıq onlara heç bir fayda verməyəcəkdir.**

**166) (اِذْ تَبَرَّاَ الَّذِينَ اتُّبِعُوا وَرَاَوُا الْعَذَابَ) - o zaman ki dünyada rəis olub xalqı zəlalətə salan zalım şəxslər axirət əzabını gördülər, üz döndərib kənar olarlar, (مِنَ الَّذِينَ اتَّبَعُوا) - dünyada onlara tabe olan şəxslərdən, (وَتَقَطَّعَتْ بِهِمُ الْاَسْبَابُ) - elə ki qiyamət əzabını gördülər, tabe olanlarla tabe edənlər arasındakı əlaqələr kəsilər, ittifaqları parçalanar, bir-birilərindən kənar olub üz döndərərlər.**

**167) (وَقَالَ الَّذِينَ اتَّبَعُوا) – tabe olanlar onların üz döndərdiyini görüb dedilər: (لَوْ اَنَّ لَنَا كَرَّةً) - kaş bizim üçün bir dəfə də dünyaya qayıtmaq imkanı olaydı, (فَنَتَبَرَّاَ مِنْهُمْ) - dünyaya qayıdıb o rəislərdən üz döndərəydik, (كَمَا تَبَرَّؤُا مِنَّا) Necə ki onlar bizdən üz döndərdilər. (كَذٰلِكَ) - necə ki axirət əzabını onlara göstərib bir-birilərindən üz döndərdilər, habelə (يُرِيهِمُ اللّٰهُ اَعْمَالَهُمْ حَسَرَاتٍ عَلَيْهِمْ) - Allah-Təala qiyamət günündə onların əməllərini elə bir halda özlərinə göstərər ki, əməlləri onlardan ötrü həsrət və peşmançılıq olar. (وَمَا هُمْ بِخَارِجِينَ مِنَ النَّارِ) - onlar od əzabından** (əməllərinin səbəbinə) **çıxan deyillər).**

**168) (اَيُّهَا النَّاسُ حَلَالًا طَيِّبًا) -** (bütün insanlara xitabdır)**, ey insanlar, (كُلُوا مِمَّا فِي الْاَرْضِ) - yer üzündə olan nemətlərdən yeyin,** (həlalən teyyibən) **– elə bir halda ki, o yediyiniz nemətlər hər bir şübhədən halal və pak olsun. (وَلَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِ) - şeytanın getdiyi yollara və onun pis əməllərinə tabe olmayıb, haram şeyləri yeməyin,** (hər bir pis əməl şeytana isnad edilir). **(اِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ) - həqiqətən, şeytan** (xəbis nəfsi-əmmarə) **sizin açıq-aşkar düşməninizdir. Heç bir ağıllı şəxs öz düşməninin əməlinə tabe olmaz.**

**169) (اِنَّمَا يَاْمُرُكُمْ بِالسُّٓوءِ وَالْفَحْشَٓاءِ) - həqiqətən, şeytan sizə pis və son dərəcə çirkin olan şeyləri əmr edir. (وَاَنْ تَقُولُوا عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ) - və şeytan sizə**

وَاِذَا قِيلَ لَهُمُ اتَّبِعُوا مَٓا اَنْزَلَ اللّٰهُ قَالُوا بَلْ نَتَّبِعُ مَٓا اَلْفَيْنَا عَلَيْهِ اٰبَٓاءَنَاۜ اَوَلَوْ كَانَ اٰبَٓاؤُ۬هُمْ لَا يَعْقِلُونَ شَيْـٔاً
وَلَا يَهْتَدُونَ ﴿١٧٠﴾ وَمَثَلُ الَّذِينَ كَفَرُوا كَمَثَلِ الَّذِي يَنْعِقُ بِمَا لَا يَسْمَعُ اِلَّا دُعَٓاءً وَنِدَٓاءًۜ صُمٌّ
بُكْمٌ عُمْيٌ فَهُمْ لَا يَعْقِلُونَ ﴿١٧١﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا كُلُوا مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ وَاشْكُرُوا لِلّٰهِ
اِنْ كُنْتُمْ اِيَّاهُ تَعْبُدُونَ ﴿١٧٢﴾

---

**əmr edir ki, Allah-Təalaya o şeyləri iftira atasınız ki, ona agah deyilsiniz, özünüzdən deyirsiniz ki, bu şey haram, bu şey halaldır, ondan sonra Allah-Təalaya isnad edirsiniz. Halal və haram Allah-Təalanın əmri ilə olar, nəinki sizin rəy və istəyinizlə.**

**170) (وَاِذَا قِيلَ لَهُمُ اتَّبِعُوا مَٓا اَنْزَلَ اللّٰهُ) – nə zaman ki xalqa deyilər: "Gəlin Allah-Təalanın nazil etdiyi Qurana tabe olun". (O vaxt ki sən ey Məhəmməd, bu sözü xalqa dedin), (قَالُوا بَلْ نَتَّبِعُ مَٓا اَلْفَيْنَا عَلَيْهِ اٰبَٓاءَنَا) – cavab verib dedilər: "Əksinə, o dinə və o yola tabe olarıq ki, o dində və o yolda ata-babalarımızı tapmışıq, çünki onlar bizdən yaxşı və alim idilər".** (Həmişə haqqın müqabilində aciz qalanda təqlidə yönəlirlər. Nə gözəl demiş Mövləvi: "Təqlid edən şəxslər bərbad olar, ey dost, təqlid edənə lənət olsun!") **Allah-Təala onların bu sözlərini rədd edib buyurur: (اَوَلَوْ كَانَ اٰبَٓاؤُ۬هُمْ لَا يَعْقِلُونَ شَيْـٔاً وَلَا يَهْتَدُونَ) – Onların ata-babaları dindən və haqq yolundan bir şey anlamayıb, doğru yolu tapmayıblarsa da, ata-babalarının yoluna tabe olurlar?** (Bu halda ki, onlara tabe olurlar, baxın, görün bunlar nə qədər axmaq camaatdırlar, alimə tabe olmaq lazımdır, nəinki cahilə, halbuki onların ata-babaları həmişə cahil olub və din və məzhəbdən bir şey bilmirdilər, buna baxmayaraq, yenə onlara tabe olurlar, bundan artıq cəhalət və axmaqlıq olarmı?)

**171) (وَمَثَلُ الَّذِينَ كَفَرُوا) - kafirləri imana dəvət edib haqq tərəfinə çağıranın misli (kafirlər imana dəvət edənin sözünə dürüst diqqət etməyib, onun sözündən, səsindən başqa heç bir şey dərk etmirdilər), (كَمَثَلِ الَّذِي يَنْعِقُ بِمَا لَا يَسْمَعُ) - o şəxsin məsəli kimidir ki, heyvanı səslədiyi halda o heyvan o şəxsin səsini eşitməz, (اِلَّا دُعَٓاءً وَنِدَٓاءً) – ancaq çağırıb səsləməsindən başqa, onun kəlamından bir şey anlamaz. (Hz. Məhəmmədin dəvət etdiyi kafirlərin halı da belədir. Onun dəvətindən heyvanlar kimi səsindən və çağırmasından başqa, bir şey dərk etmirdilər. (صُمٌّ بُكْمٌ عُمْيٌ) – haqqı eşitməkdə, haqqı deməkdə, haqqı görmədə qulaqları kar, dilləri lal, gözləri kordur. (فَهُمْ لَا يَعْقِلُونَ) - onlar Hz. Məhəmmədin (ə.s) kəlamından ağıllı şəxslər kimi bir şey anlamazlar. Amma özlərini ağıllı hesab edirlər.**

**172) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا) - ey iman gətirən şəxslər, (كُلُوا مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ) - sizə ruzi olaraq verdiyimiz ləziz və dadlı nemətlərdən yeyin. (وَاشْكُرُوا لِلّٰهِ اِنْ كُنْتُمْ اِيَّاهُ تَعْبُدُونَ) - əgər ancaq Allah-Təalaya ibadət edib Ondan başqasına ibadət etməyi tərk edənsinizsə, gərək Allah-Təalanın nemətlərinə şükür**

اِنَّمَا حَرَّمَ عَلَيْكُمُ الْمَيْتَةَ وَالدَّمَ وَلَحْمَ الْخِنْزِيرِ وَمَٓا اُهِلَّ بِه۪ لِغَيْرِ اللّٰهِۚ فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ فَلَٓا
اِثْمَ عَلَيْهِۜ اِنَّ اللّٰهَ غَفُورٌ رَح۪يمٌ ﴿١٧٣﴾ اِنَّ الَّذ۪ينَ يَكْتُمُونَ مَٓا اَنْزَلَ اللّٰهُ مِنَ الْكِتَابِ وَيَشْتَرُونَ بِه۪ ثَمَنًا
قَل۪يلًاۙ اُو۬لٰٓئِكَ مَا يَاْكُلُونَ ف۪ي بُطُونِهِمْ اِلَّا النَّارَ وَلَا يُكَلِّمُهُمُ اللّٰهُ يَوْمَ الْقِيٰمَةِ وَلَا يُزَكّ۪يهِمْۚ

---

**edəsiniz.** (Əlbəttə, Allah-Təalaya ibadət edən gərək həmişə Allah-Təalaya şükür etsin)**. Allah əvvəlki ayədə insan təbiətinin adət etdiyi, çəkinmədiyi, ağlın da murdar saymadığı yeməkləri yeməyi əmr etdi. Sıradakı ayədə isə insan təbiətinin adət etdiyi, ancaq ağlın o yeməyin haram olmasını dərk etmədiyi, lakin şəriət tərəfindən murdar sayılan şeyləri haram buyurdu.**

**173) (اِنَّمَا حَرَّمَ عَلَيْكُمُ) - həqiqətən, Allah-Təala sizə bəzi şeyləri haram edibdir. (الْمَيْتَةَ) – ilki - ölü heyvanın ətini** (məsələn, qoyun, keçi, inək, dəvə və bunlardan başqa, pak və halal olan heyvanlar ki, (kəsilmədən) ölü olsa və təmiz olmasa, onun ətini yemək haramdır)**. (وَالدَّمَ) – ikincisi, heyvan kəsilən vaxtı onun axıb tökülən qanını sizə haram edibdir. (وَلَحْمَ الْخِنْزِيرِ) – üçüncüsü, sizə donuz ətini yeməyi haram edibdir. (وَمَٓا اُهِلَّ بِه۪ لِغَيْرِ اللّٰهِ) – dördüncüsü, sizə Allah-Təaladan başqasının adı ilə kəsilməyən heyvanın ətini haram edibdir.** (Müşriklər heyvanı kəsəndə Lat və Üzza, ya da digər bütlərin adına o heyvanı kəsərdilər. Allah-Təala buyurur: Allah-Təaladan başqasının adı ilə kəsilən heyvanın ətini yemək haramdır). **(فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ) – lakin kim ki naəlac qalsa, aclıq vaxtı bu haram şeylərdən yeməyə başlasa, o vaxt yemək caizdir. Amma bir halda ki, başqa bir ac şəxsə zülm etməyib onun əlindən almasın, ya da lazım olandan artıq yeməyib həddi aşmasın, ya da götürüb anbarda saxlamasın. Əgər kiməsə zülm edib onun əlindən alıb yesə, ya da həddindən artıq yesə və ya götürüb anbarda saxlasa, o zaman bu qeyd olunan şeylər yenə haram olar. (فَلَٓا اِثْمَ عَلَيْهِ) – naəlac şəxsin o haramları yeməsində bir günah yoxdur. (اِنَّ اللّٰهَ غَفُورٌ رَح۪يمٌ) - həqiqətən, Allah-Təala günahkarların günahını tövbə edən zaman bağışlayıb, bütün məxluqata rəhm edəndir.**

**174) (اِنَّ الَّذ۪ينَ يَكْتُمُونَ مَٓا اَنْزَلَ اللّٰهُ مِنَ الْكِتَابِ) - həqiqətən, o şəxslər ki Allah-Təalanın öz kitablarında nazil etdiyi hökmləri gizlədib xalqa bəyan etmir,** (bu hökm Tövrat əhli, İncil əhli, Quran əhli üləmalarının hamısına şamildir), **(وَيَشْتَرُونَ بِه۪ ثَمَنًا قَل۪يلًا) - və o gizlətməyin əvəzində avamlardan bir az pul** (rüşvət) **alırlar, (اُو۬لٰٓئِكَ مَا يَاْكُلُونَ ف۪ي بُطُونِهِمْ اِلَّا النَّارَ) - bu üləmalar qarınlarına oddan başqa heç bir şey doldurub yemirlər. O yedikləri qiyamət günündə od olub onları yandıracaqdır. O səbəbə görə, sanki, qarınlarına od doldurub yeyirlər.** (Vay olsun islam üləmasının əhvalına. Bu ayəyə baxıb ibrət alsınlar, Qurani-Şərifin hökmlərini xalqdan gizlədib, bu hökmləri bildirənə də küfr və zındıqlıq isnad etməsinlər). **(وَلَا يُكَلِّمُهُمُ اللّٰهُ يَوْمَ الْقِيٰمَةِ) - Allah-Təala onlarla qiyamət günündə danışmaz, necə ki möminlərlə danışır. (وَلَا يُزَكّ۪يهِمْ)**

وَلَهُمْ عَذَابٌ اَلِيمٌ ﴿١٧٤﴾ اُولٰٓئِكَ الَّذِينَ اشْتَرَوُا الضَّلَالَةَ بِالْهُدٰى وَالْعَذَابَ بِالْمَغْفِرَةِۚ فَمَآ اَصْبَرَهُمْ عَلَى النَّارِ ﴿١٧٥﴾ ذٰلِكَ بِاَنَّ اللّٰهَ نَزَّلَ الْكِتَابَ بِالْحَقِّۜ وَاِنَّ الَّذِينَ اخْتَلَفُوا فِي الْكِتَابِ لَفِي شِقَاقٍ بَعِيدٍ ﴿١٧٦﴾ لَيْسَ الْبِرَّ اَنْ تُوَلُّوا وُجُوهَكُمْ قِبَلَ الْمَشْرِقِ وَالْمَغْرِبِ وَلٰكِنَّ الْبِرَّ مَنْ اٰمَنَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ وَالْمَلٰٓئِكَةِ وَالْكِتَابِ وَالنَّبِيِّنَۚ وَاٰتَى الْمَالَ عَلٰى حُبِّهٖ ذَوِي الْقُرْبٰى وَالْيَتَامٰى وَالْمَسَاكِينَ وَابْنَ السَّبِيلِ وَالسَّٓائِلِينَ

---

**- Allah-Təala onları hər bir nöqsan və eyibdən pak etməz. (وَلَهُمْ عَذَابٌ اَلِيمٌ) - onlardan ötrü qiyamət günündə şiddətli əzab vardır.**

**175) (اُولٰٓئِكَ الَّذِينَ اشْتَرَوُا الضَّلَالَةَ بِالْهُدٰى) - Allah-Təalanın hökmlərini gizlədənlər o şəxslərdir ki, hidayətin əvəzinə zəlaləti seçib aldılar. (وَالْعَذَابَ بِالْمَغْفِرَةِ) – bağışlanmağın əvəzinə əzabı seçdilər. (فَمَآ اَصْبَرَهُمْ عَلَى النَّارِ) - nə qədər də od əzabına səbir edəndirlər,** (od əzabına bais olan əməlləri edib özlərini əzaba salırlar), (onların işləri çox təəccüblüdür)**.**

**176) (ذٰلِكَ) - Allah-Təalanın hökmlərini dəyişdirənlərə od əzabı vermək, (بِاَنَّ اللّٰهَ نَزَّلَ الْكِتَابَ بِالْحَقِّ) - o səbəbə görədir ki, Allah-Təala xalqdan ötrü haqq ilə kitab nazil edib və o kitabda hökmlər bəyan edib, kitaba agah olanlar o hökmləri gizlədib, xalqa bəyan etmirlər. (وَاِنَّ الَّذِينَ اخْتَلَفُوا فِي الْكِتَابِ) - həqiqətən, o şəxslər ki Allah-Təalanın kitabında ixtilaf edib, onun ehkamını dəyişdirdilər, (لَفِي شِقَاقٍ بَعِيدٍ) - hər halda haqdan uzaq olan zidd bir əməl içindədirlər.**

(Yəhudilər, xristianlar və müsəlmanlar qiblə məsələsində ixtilaf edib, hər biri öz qibləsinin haqq olması haqqında dəlil gətirib münaqişə edirdilər. (Təbərsi, I/475) O vaxt aşağıdakı ayə nazil oldu).

**177) (لَيْسَ الْبِرَّ اَنْ تُوَلُّوا وُجُوهَكُمْ قِبَلَ الْمَشْرِقِ وَالْمَغْرِبِ) - xeyir əməl o deyil ki, ibadət vaxtı üzünüzü məşriq, ya da məğrib tərəfinə döndərib ibadət edəsiniz.** (Məşriq və məğribdə bir xüsusiyyət yoxdur)**. (وَلٰكِنَّ الْبِرَّ مَنْ اٰمَنَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) - əksinə, xeyir əməl o şəxsin əməlidir ki, Allah-Təalaya və axirət gününə iman gətirir, (وَالْمَلٰٓئِكَةِ وَالْكِتَابِ وَالنَّبِيِّنَ)- və iman gətirir mələklərə, Allah-Təalanın kitabına və peyğəmbərlərinə, (وَاٰتَى الْمَالَ عَلٰى حُبِّهٖ) - malını sevdiyi halda o malından Allah-Təalanın əmr etdiyi yerlərdə ehsan edib ümmətin ehtiyacı üçün sərf edir,** (sevdiyi malından ehsanı hansı şəxsə, hansı məqamda etməlidir onu aşağıda bəyan edir:) **(ذَوِي الْقُرْبٰى) - ehsan edər onunla eyni soydan olan qohum-əqrəbasına, (وَالْيَتَامٰى) - ümmətin yetimlərinə, (وَالْمَسَاكِينَ وَابْنَ السَّبِيلِ وَالسَّٓائِلِينَ) - yoxsullara və o müsafirlərə ki, öz vilayətlərində mal sahibi olsalar da səfər əsnasında pulu qurtaranlara.** (Onlara gərək o qədər ehsan olunsun ki, səfərlərini tamamlaya bilsinlər). **Bir də eh-**

وَفِي الرِّقَابِۚ وَاَقَامَ الصَّلٰوةَ وَاٰتَى الزَّكٰوةَۚ وَالْمُوفُونَ بِعَهْدِهِمْ اِذَا عَاهَدُواۚ وَالصَّابِرِينَ فِي الْبَاْسَاۤءِ
وَالضَّرَّاۤءِ وَحِينَ الْبَاْسِۜ اُولٰٓئِكَ الَّذِينَ صَدَقُواۜ وَاُولٰٓئِكَ هُمُ الْمُتَّقُونَ﴿١٧٧﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا
كُتِبَ عَلَيْكُمُ الْقِصَاصُ فِي الْقَتْلٰىۜ اَلْحُرُّ بِالْحُرِّ وَالْعَبْدُ بِالْعَبْدِ وَالْاُنْثٰى بِالْاُنْثٰىۜ

---

**san edin naəlac qalıb dilənənlərə,** (nəinki dilənməyi özlərindən ötrü sənət seçənlərə), **(وَفِي الرِّقَابِ) - bir də o qulam və kənizlərə ki, sahibləri onlara əziyyət edir, onları alıb azad edin.** (Köləlik islamda pis görüldüyünə görə, hər bir məqamda qulam və kənizi alıb azad etmək əmr olunubdur)**. (وَاَقَامَ الصَّلٰوةَ وَاٰتَى الزَّكٰوةَ) - və yenə ehsan sahibi o şəxslərdir ki, namaz qılıb zəkat verər, (وَالْمُوفُونَ بِعَهْدِهِمْ اِذَا عَاهَدُوا) - əhd etdiklərində əhdlərinə vəfa edərlər. (وَالصَّابِرِينَ فِي الْبَاْسَاۤءِ وَالضَّرَّاۤءِ وَحِينَ الْبَاْسِ) - şıddətli yoxsulluqda, xəstəlikdə, düşmənlə savaşda möhkəm olub səbir edərlər. (اُولٰٓئِكَ الَّذِينَ صَدَقُوا) - din yolunda doğru olanlar bu qeyd olunan əməllərin sahibləridirlər. (وَاُولٰٓئِكَ هُمُ الْمُتَّقُونَ) - müttəqi şəxslər də onlardır.** (Allah-Təala sıradakı ayəni qətl haqqında buyurubdur. Əgər müsəlmanlar bu ayəyə əməl etsələr, onların arasında bu qədər qətl hadisəsi meydana gəlməz, hətta bu ayənin hökmü müsəlmanlar arasında işləmədiyindən qətl hadisələrinin çoxalmasına səbəb olub. Görəsən, müsəlmanlar nə zaman Quran ehkamının tərəqqi səbəbi olduğunu anlayıb, bu nəsihətverici qanunlara tabe olacaqlar? Ah, ah, ah!)

**178) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا) - ey iman gətirən şəxslər, (كُتِبَ عَلَيْكُمُ الْقِصَاصُ فِي الْقَتْلٰى) – öldürülən şəxslərin haqqında sizdən ötrü qisas yazılıb hökm olundu.** (Yəni Allah-Təala sizə ixtiyar verib ki, kim ki bir başqasını qətl etsə, onun qatilindən qisas alıb öldürülənin əvəzində onu qətlə yetirəsiniz. Bu ayə və bundan başqa, bir neçə ayələrdə vaqe olan yazılma sözündən məqsəd odur ki, bu hökmlər sabit və bərqərar olub, onlarda əsla dəyişiklik olmaz. Necə ki bir şey yazıldı, sabit qalıb yox olmaz. Habelə bu hökm də sabit və bərqərar olan hökmdür). **(اَلْحُرُّ بِالْحُرِّ) - azad şəxsi azad şəxsin əvəzində qətlə yetirək, (وَالْعَبْدُ بِالْعَبْدِ) - qulamı qulam əvəzində,** (qulamın əvəzində azad şəxs öldürülə bilməz, onun diyeti - qan bahası verilər). **(وَالْاُنْثٰى بِالْاُنْثٰى) - qadın qadının əvəzində,** (əgər bir kişi bir qadını qətl etsə, o qadının varislərinin ixtiyarı var ki, o kişini qətl etsinlər, ya da qadının diyetini alıb, diyetin yarısını qaytarsınlar, çünki qadının diyeti kişinin diyetinin yarısıdır). **Qətl üç cürdür: birincisi – qəsdən qətl etməkdir, yəni biri digərini qəsdən zülmlə öldürər. İkincisi – səhvən qətl etməkdir, yəni qəsd olmaz, məsələn, bir şəxs ovda heyvana atdığı zaman insana dəyər. Üçüncüsü – qəsdə oxşayandır, məsələn, bir şəxs öz övladını, ya da müəllim şagirdini tənbeh etdiyi zaman, vurduğu zaman ölsə, öncə qisas vardır, amma qan sahibinin qisasdan vaz keçib diyet almağa ixtiyarı vardır. Amma digər iki halda qisas yoxdur, gərək diyet verilsin. Diyetin təfsilatı bundan sonra gələn Nisa surəsində bəyan olunacaqdır.**

فَمَنْ عُفِيَ لَهُ مِنْ اَخِيهِ شَيْءٌ فَاتِّبَاعٌ بِالْمَعْرُوفِ وَاَدَآءٌ اِلَيْهِ بِاِحْسَانٍ ذٰلِكَ تَخْفِيفٌ مِنْ رَبِّكُمْ وَرَحْمَةٌ
فَمَنِ اعْتَدٰى بَعْدَ ذٰلِكَ فَلَهُ عَذَابٌ اَلِيمٌ ﴿١٧٨﴾ وَلَكُمْ فِي الْقِصَاصِ حَيٰوةٌ يَآ اُولِي الْاَلْبَابِ لَعَلَّكُمْ
تَتَّقُونَ ﴿١٧٩﴾ كُتِبَ عَلَيْكُمْ اِذَا حَضَرَ اَحَدَكُمُ الْمَوْتُ اِنْ تَرَكَ خَيْرًا اَلْوَصِيَّةُ

---

**(فَمَنْ عُفِيَ لَهُ مِنْ اَخِيهِ شَيْءٌ) - bir qatil öz din qardaşı olan bəzi varislər tərəfindən bağışlansa,** (məsələn, qisas haqqı olan bəzi varislər öz haqlarından vaz keçib qatili bağışlasa, o vaxt digər varislər o qatili qətlə yetirə bilməzlər. O zaman gərək ondan diyet alınsın), **(فَاتِّبَاعٌ بِالْمَعْرُوفِ) – o zaman ki qan sahibi olan bəzi varislər qisasdan vaz keçsə, ondan sonra digər qan sahibləri qatildən diyet almaqda gərək yaxşı rəftar edib diyetdən artıq bir şey tələb etməsinlər. (وَاَدَآءٌ اِلَيْهِ بِاِحْسَانٍ) - qatil də gərək diyetini təxirə salmayıb, az etməyib, diyeti yaxşılıqla qan sahiblərinə yetirsin. (ذٰلِكَ تَخْفِيفٌ مِنْ رَبِّكُمْ وَرَحْمَةٌ) - bu hökm** (qisasdan vaz keçib diyet almaq) **ki, qeyd olundu, rəbbiniz Allah-Təaladan sizin üçün yüngüllük** (qətl hökmünü yüngülləşdirmək) **və mərhəmətdir.** (Amma Tövrat əhli üçün Tövratda qətl barəsində hökm qisasdır, diyet almaq caiz deyildir). **(فَمَنِ اعْتَدٰى بَعْدَ ذٰلِكَ) - kim ki Allah-Təalanın təyin etdiyi həddi aşıb artıq alsa, ya qatildən başqasını qətlə yetirsə və ya qatil öz diyetini verməsə, ya da əskik versə, (فَلَهُ عَذَابٌ اَلِيمٌ) - o şəxsdən ötrü qiyamət günündə şiddətli əzab vardır.**

**179) (وَلَكُمْ فِي الْقِصَاصِ حَيٰوةٌ يَآ اُولِي الْاَلْبَابِ) - ey ağıl sahibləri, sizdən ötrü bu qeyd olunan qisasda böyük həyat vardır.** (Ərəblər bir öldürülənin əvəzində bir neçə nəfəri qətlə yetirərdilər. O səbəbdən əmr olundu ki, öldürülənin əvəzində də ancaq bir nəfər onun qatili öldürülsün. O zaman başqaları da sağ qalar. Onların sağ qalması sizdən ötrü böyük həyatdır. Millət və camaatınız artıb, düşmən sizə qalib ola bilməz. Bir də insan agah olsa ki, kimisə öldürsə, onun özünü də qətlə yetirərlər, o vaxt qətl etməkdən çəkinər, bu da sizdən ötrü bir növ həyatdır ki, həm qatil, həm də öldürülənin hər ikisi sağ qalar. İçinizdən iki nəfər artıq olar. Bu mətləb Quran əhlinə necə məxfi qalıb, özləri islamın pərişan və məhv olmasına səbəb olublar). **(لَعَلَّكُمْ تَتَّقُونَ) - qisasın faydasını sizə məlum etdim. Əlbəttə, gərək, təqvalı olub qisasın hökmünü mühafizə edib, ona əməl edib zay etməyəsiniz.** (Allah-Təalanın belə uca fərmanını və qəti hökmünü biz müsəlmanlar tərk edəndən sonra yenə bizim sözümüz var ki, deyək: "Nədən ötrü biz müsəlmanlar günbəgün geri gedib, əlacsız bir xəstəliyə düçar olmuşuq? O xəstəliyin səbəbi Qurani-Şərifin ehkamını tərk etməkdir").

**180) (كُتِبَ عَلَيْكُمْ) - yazıldı, vacib oldu sizə, (اِذَا حَضَرَ اَحَدَكُمُ الْمَوْتُ) – o zaman ki sizdən bir nəfərə ölüm gəldi, (اِنْ تَرَكَ خَيْرًا) - əgər öləndən sonra mal qoyub getsə, o zaman sizə yazıldı və vacib oldu ki, (اَلْوَصِيَّةُ) - o malınızdan gərək**

لِلْوَالِدَيْنِ وَالْاَقْرَبِينَ بِالْمَعْرُوفِۚ حَقًّا عَلَى الْمُتَّقِينَ ﴿١٨٠﴾ فَمَنْ بَدَّلَهُ بَعْدَ مَا سَمِعَهُ فَاِنَّمَآ اِثْمُهُ
عَلَى الَّذِينَ يُبَدِّلُونَهُ اِنَّ اللّٰهَ سَمِيعٌ عَلِيمٌ ﴿١٨١﴾ فَمَنْ خَافَ مِنْ مُوصٍ جَنَفًا اَوْ اِثْمًا فَاَصْلَحَ بَيْنَهُمْ

---

**vəsiyyət edəsiniz. (لِلْوَالِدَيْنِ) - ata və anadan ötrü, (yəni əgər çox mal qoyub gedən zaman vəsiyyət edin ki, ata və ananıza onlara yetişən hissədən başqa bir qədər malınızdan da verilsin. (وَالْاَقْرَبِينَ) - yenə vəsiyyət edin sizinlə soy baxımından yaxın olan qohum-əqrəbalardan ötrü,* onlara da malınızdan bir qədər verilsin. (بِالْمَعْرُوفِ) - bu vəsiyyət gərək ədalət üzrə olsun. Yoxsul olub varlıdan ötrü vəsiyyət etməyin.**

*(****Qeyd:*** Bütün şəriət ehkamları siyasət mövzusunu ehtiva edir. Aqil şəxs, gərək, bir qədər təfəkkür edib nəticə çıxartsın. Məsələn, həmin ayədə buyurulur: "Malınızdan ata-anadan başqa əqrəbalara da vəsiyyət edin". Keçən 176-cı ayədə buyurdu: "Qohum-əqrəbalara, yetimlərə, yoxsullara, yolda qalanlara, dilənçilərə, qulam və kənizləri alıb azad etmək üçün ehsan edin". Bu mətləb cəmiyyətin və islamın sabitliyinin səbəbidir. İnsan ehsanın, yaxşılığın quludur. Nə zaman bu xeyir əməl müsəlmanların arasında yayılsa, başqa millətlər də islama meyil edib yönələrlər. Amma əfsus və heyif olsun ki, sair millətlər bu gözəl yolla gedib, ölüm anında öz din və millətlərinin xeyir və mənfəətinə səbəb olan vəsiyyətlər edirlər. Amma bizim müsəlmanlar haqq sahibinin də haqqını verməyib, ömrü boyu yığdığı mal-dövləti bir qrup fasiqə həvalə edib, əbədi lənət qazanıb, dünyadan elə gedərlər).*

**Vəsiyyət olunan mal gərək üçdə birdən artıq olmasın.** (Çünki şəxs ölən zaman malının üçdə birindən artığını vəsiyyət etməyə ixtiyarı yoxdur. Üçdə birindən artığı varisin ixtiyarındadır). **(حَقًّا عَلَى الْمُتَّقِينَ) - bu vəsiyyət müttəqi olan şəxslərin üzərinə haqdır, gərək bu vəsiyyəti etsinlər.** (Bu ayə bu vəsiyyətin vacib olmasının açıq-aşkar dəlildir, amma təəssüf ki, bu vəsiyyətə müstəhəb (savab) deyiblər).

**181) (فَمَنْ بَدَّلَهُ) – varislərdən kim o vəsiyyəti edən şəxsin vəsiyyətini dəyişdirsə, (بَعْدَ مَا سَمِعَهُ) – eşitdikdən və təhqiq etdikdən, şəriətə müvafiq olan o vəsiyyət onun yanında sabit olandan sonra o vəsiyyəti dəyişdirsə, əlbəttə, onda böyük günah vardır. (فَاِنَّمَآ اِثْمُهُ) - həqiqətən, o vəsiyyəti dəyişdirməyin günah və müsibəti, (عَلَى الَّذِينَ يُبَدِّلُونَهُ) - o şəxslərədir ki, o vəsiyyəti dəyişdirirlər. (اِنَّ اللّٰهَ سَمِيعٌ عَلِيمٌ) - həqiqətən, Allah-Təala hər kəsin sözlərini eşidir, onların əməllərindən agahdır. Kim ilahi hökmə xilaf bir əməl etsə, Allah-Təala ona lazımınca əzab edəcəkdir.**

**182) (فَمَنْ خَافَ مِنْ مُوصٍ جَنَفًا اَوْ اِثْمًا) - kim vəsiyyət edənin vəsiyyətində xəta edib, haqdan batil tərəfinə meyil etməkdə qəsdən günahkar olub şəriətə zidd vəsiyyət etməsinə agah olsa, (فَاَصْلَحَ بَيْنَهُمْ) - o vəsiyyətə agah olan şəxs vəsiyyəti batildən haqq tərəfinə dəyişdirib vəsiyyət olunan şəxslərin ara-**

فَلَآ اِثْمَ عَلَيْهِ اِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ ﴿١٨٢﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا كُتِبَ عَلَيْكُمُ الصِّيَامُ كَمَا كُتِبَ عَلَى الَّذِينَ
مِنْ قَبْلِكُمْ لَعَلَّكُمْ تَتَّقُونَ ﴿١٨٣﴾ اَيَّامًا مَعْدُودَاتٍ فَمَنْ كَانَ مِنْكُمْ مَرِيضًا اَوْ عَلٰى سَفَرٍ فَعِدَّةٌ مِنْ اَيَّامٍ
اُخَرَ وَعَلَى الَّذِينَ يُطِيقُونَهُ فِدْيَةٌ طَعَامُ مِسْكِينٍ فَمَنْ تَطَوَّعَ خَيْرًا فَهُوَ خَيْرٌ لَهُ وَاَنْ تَصُومُوا خَيْرٌ لَكُمْ

---

**sında şəriətə müvafiq islah etsə, (فَلَآ اِثْمَ عَلَيْهِ) - o şəxsə heç bir günah yoxdur. Məsələn, bir şəxs öz malının yarısını ata-anasına, qardaşına, ya da filan xeyir əməldə sərf olunması üçün vəsiyyət etsə, o şəxsin övladları, ya da varisləri gərək bu vəsiyyətə razı olmasınlar.** (Çünki bir şəxsin malının üçdə birindən artığını vəsiyyət etməyə ixtiyarı yoxdur). **Alim bir şəxs əgər bu vəsiyyəti malın üçdən bir hissəsi qədər dəyişdirsə, bu dəyişiklikdə ona heç bir günah yoxdur. (اِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ) - həqiqətən, Allah-Təala vəsiyyətlərində xəta edib, günahkar olanlara rəhm edib, onların günahını bağışlayandır.** (Bundan sonra gələn bir neçə ayədə Allah-Təala orucun hökmünü bəyan edir).

**183) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا) - ey iman gətirən şəxslər, (كُتِبَ عَلَيْكُمُ الصِّيَامُ) - sizə oruc tutmaq yazılıb, vacib oldu, xəyal etməyin ki, bu oruc tutmaq təkcə sizə vacib olubdur. (كَمَا كُتِبَ عَلَى الَّذِينَ مِنْ قَبْلِكُمْ) - necə ki sizdən əvvəlki ümmətlərə də yazılıb vacib olmuşdu. Belə deyil ki, oruc təkcə sizə vacib olub, əksinə, oruc qədim bir ibadətdir, babanız Adəmdən bəri bütün ümmətlərə vacib olubdur.** (Oruc çətin bir ibadət olduğundan gör Allah-Təala onun vacib olmasını xalqa necə tədbir və hikmət üzrə bəyan edir). **(لَعَلَّكُمْ تَتَّقُونَ) - əlbəttə, siz oruc tutduğunuz üçün gərək təqvalı olub, günah və müsibəti tərk edəsiniz. Orucun ədəb və ehkamına riayət edib, son dərəcə təzim və hörmətlə onu yerinə yetirəsiniz.**

**184) (اَيَّامًا مَعْدُودَاتٍ) - sizə vacib olan oruc müəyyən sayda bir neçə gündür.** (Yəni qorxub deməyin ki, bizim oruc tutmağa taqətimiz yoxdur. Çünki müəyyən sayda olan günlər az olur. Bir neçə gün oruc tutmaqla sizə nə əziyyət olacaqdır? Orucun vaxtını və günlərinin sayını, miqdarını bəyan etməmiş əvvəlcə ehkamının asan və yüngül olduğunu bəyan edir). **(فَمَنْ كَانَ مِنْكُمْ مَرِيضًا) - sizdən kim oruc zamanında xəstə olsa, (اَوْ عَلٰى سَفَرٍ) - ya da səfərdə olsa,** (xəstə və səfərdə olduğu günlərdə oruc tutmasın). **(فَعِدَّةٌ مِنْ اَيَّامٍ اُخَرَ) - neçə gün xəstəlik olanda, ya da səfərdə oruc tutmayıb, o günlərin əvəzində başqa günlərdə oruc tutsun. (وَعَلَى الَّذِينَ يُطِيقُونَهُ فِدْيَةٌ طَعَامُ مِسْكِينٍ) – o qoca kişi və qoca qadınlar ki, oruc tutmağa qüdrətləri var, oruc tutmaqla tutmamaq arasında sərbəstdirlər, əgər tutmasalar, o günün orucunun əvəzində bir nəfər yoxsula yemək versinlər. (فَمَنْ تَطَوَّعَ خَيْرًا) - kimin qüvvəsi olub yoxsula artıq yemək versə, iki, ya da üç yoxsula yemək versə, (فَهُوَ خَيْرٌ لَهُ) – bu, onlar üçün daha yaxşıdır. (وَاَنْ تَصُومُوا خَيْرٌ لَكُمْ) - ey qoca kişilər və qoca qadınlar, sizə oruc tutmağın əvəzində ixtiyar verildi, belə olan halda sizin üçün oruc**

اِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿١٨٤﴾ شَهْرُ رَمَضَانَ الَّذِيٓ اُنْزِلَ فِيهِ الْقُرْاٰنُ هُدًى لِلنَّاسِ وَبَيِّنَاتٍ مِنَ الْهُدٰى
وَالْفُرْقَانِۚ فَمَنْ شَهِدَ مِنْكُمُ الشَّهْرَ فَلْيَصُمْهُۜ وَمَنْ كَانَ مَرِيضًا اَوْ عَلٰى سَفَرٍ فَعِدَّةٌ مِنْ اَيَّامٍ اُخَرَۜ يُرِيدُ
اللّٰهُ بِكُمُ الْيُسْرَ وَلَا يُرِيدُ بِكُمُ الْعُسْرَۘ وَلِتُكْمِلُوا الْعِدَّةَ وَلِتُكَبِّرُوا اللّٰهَ عَلٰى مَا هَدٰيكُمْ وَلَعَلَّكُمْ تَشْكُرُونَ
﴿١٨٥﴾ وَاِذَا سَاَلَكَ عِبَادِي عَنِّي فَاِنِّي قَرِيبٌۜ اُجِيبُ دَعْوَةَ الدَّاعِ اِذَا دَعَانِۙ فَلْيَسْتَجِيبُوا لِي وَلْيُؤْمِنُوا
بِي لَعَلَّهُمْ يَرْشُدُونَ ﴿١٨٦﴾

---

**tutmaq əvəz verməkdən daha yaxşıdır. Hərçənd artıq əvəz versəniz də, (اِنْ كُنْتُمْ تَعْلَمُونَ) – gərək oruc tutmağın əvəz verməkdən yaxşı olduğuna agah olduğunu biləsiniz.**

**185) (شَهْرُ رَمَضَانَ الَّذِيٓ اُنْزِلَ فِيهِ الْقُرْاٰنُ هُدًى لِلنَّاسِ وَبَيِّنَاتٍ مِنَ الْهُدٰى وَالْفُرْقَانِ) - o bir neçə gün ki oruc sizə vacib olubdur, o Ramazan ayıdır. Ramazan ayı elə bir mübarək aydır ki, Quranın nazil olması o ay başlayıbdır). (فَمَنْ شَهِدَ مِنْكُمُ الشَّهْرَ فَلْيَصُمْهُ) - sizdən kim Ramazan ayına çatdı, müsafir və xəstə olmadı, əlbəttə, gərək Ramazan ayında oruc tutsun. (وَمَنْ كَانَ مَرِيضًا) - kim naxoş olsa, (اَوْ عَلٰى سَفَرٍ) – ya da səfərdə olsa, naxoş və səfərdə olan günlərdə oruc tutmasın. (فَعِدَّةٌ مِنْ اَيَّامٍ اُخَرَ) –** (onun əvəzinə) **bir neçə başqa gün oruc tutsun.** (Bu hökmü təkid etmək üçün yenidən təkrarlandı). **(يُرِيدُ اللّٰهُ بِكُمُ الْيُسْرَ وَلَا يُرِيدُ بِكُمُ الْعُسْرَ) - Allah-Təala sizin üçün hər bir işdə asanlığı istəyib, müşkül və çətinliyi istəməyibdir. O səbəbdən Allah-Təala əmr edibdir ki, xəstəlik və səfər halında oruc tutmayasınız. (وَلِتُكْمِلُوا الْعِدَّةَ) – siz də, gərək, Ramazan ayında boş gedən günlərin sayını tamamlayıb, qəza edəsiniz. (وَلِتُكَبِّرُوا اللّٰهَ عَلٰى مَا هَدٰيكُمْ) - gərək, Allah-Təalanı böyük hesab edib, təzim edəsiniz. O səbəbə görə ki, sizi oruc tutmağa hidayət edibdir. (وَلَعَلَّكُمْ تَشْكُرُونَ) - Allah-Təala sizin üçün asan hökmlər verdiyindən, gərək, Allah-Təalaya şükür edəsiniz.**

**186) (وَاِذَا سَاَلَكَ عِبَادِي عَنِّي) -** (ey Məhəmməd), **o zaman ki mənim bəndələrim məni səndən soruşdular: bəs Allah-Təala bizə yaxındır ki, Ondan soruşanda bizə cavab versin, yoxsa bizdən uzaqdır? ( فَاِنِّي قَرِيبٌ) - onlara de ki,** (ey Məhəmməd), **həqiqətən, mən onlara yaxınam, (اُجِيبُ دَعْوَةَ الدَّاعِ اِذَا دَعَانِ) - dua edib məni çağıranın duasını çağırdığı zaman qəbul edərəm. (فَلْيَسْتَجِيبُوا لِي) – o zaman ki mən onları iman və itaət tərəfinə dəvət etdim, onlar da gərək mənim dəvətimi qəbul edib, oruc tutub onun ehkamını mühafizə etsinlər. Necə ki mən onların duasını qəbul edirəm. (وَلْيُؤْمِنُوا بِي) - əlbəttə, gərək, mənə iman etsinlər. (لَعَلَّهُمْ يَرْشُدُونَ) - əlbəttə, mənə iman gətirmək səbəbinə hidayət tapıb, din və dünya işlərinə agah olarlar.** (Və agah olarlar ki, oruc gözəl bir ibadətdir. Dünya və axirət mənfəətinin hər ikisi onda vardır). (Hz. Peyğəmbərin zamanında ramazan ayında oruc tutanlardan ötrü axşam iftardan sonra cinsi əlaqə halal idi. Necə ki bu zamanda da halaldır). **Amma ilk dövrlərdə elə ki şəxs iftarı təxirə saldı, ta ki işa namazını**

اُحِلَّ لَكُمْ لَيْلَةَ الصِّيَامِ الرَّفَثُ اِلٰى نِسَآئِكُمْ ۜ هُنَّ لِبَاسٌ لَكُمْ وَاَنْتُمْ لِبَاسٌ لَهُنَّ ۜ عَلِمَ اللّٰهُ اَنَّكُمْ كُنْتُمْ تَخْتَانُونَ اَنْفُسَكُمْ فَتَابَ عَلَيْكُمْ وَعَفَا عَنْكُمْ ۚ فَالْئٰنَ بَاشِرُوهُنَّ وَابْتَغُوا مَا كَتَبَ اللّٰهُ لَكُمْ ۠ وَكُلُوا وَاشْرَبُوا حَتّٰى يَتَبَيَّنَ لَكُمُ الْخَيْطُ الْاَبْيَضُ مِنَ الْخَيْطِ الْاَسْوَدِ مِنَ الْفَجْرِ ۖ ثُمَّ اَتِمُّوا الصِّيَامَ اِلَى الَّيْلِ ۚ

---

**qıldı, ya da iftar etməmiş yatdı, ondan sonra həm iftar etmək, həm cinsi əlaqədə olmaq oruc tutana haram idi. Gərək ertəsi gün o halətlə oruc tutaydılar. Bir gecə Ömər ibn Xəttab iftardan əvvəl işa namazından sonra xanımı ilə əlaqədə oldu. Ondan sonra qüsl edib, elə ki qüsldən çıxdı, başladı ağlayıb özünü məzəmmət etməyə. Hz. Peyğəmbərin hüzuruna gəlib ərz etdi: "Ey peyğəmbər, səndən və Allah-Təaladan bu xətanı etdiyim üçün üzr istəyirəm". Ondan sonra öz əməlini peyğəmbərə xəbər verdi. Hz. Peyğəmbər (ə.s) buyurdu: "Ey Ömər, heç layiq deyil idi ki, belə əməl edəsən". Ondan sonra bir neçə kişi də ayağa durub, onlar da Ömər kimi etdikləri əməli iqrar etdilər. O vaxt bu ayə nazil oldu.**

**187) (اُحِلَّ لَكُمْ لَيْلَةَ الصِّيَامِ الرَّفَثُ اِلٰى نِسَآئِكُمْ) - oruc gecəsində xanımlarınızla əlaqədə olmaq sizə halal oldu. Nə zaman ki istədiniz, (هُنَّ لِبَاسٌ لَكُمْ) - xanımlarınız sizin libasınız kimidir. (وَاَنْتُمْ لِبَاسٌ لَهُنَّ) - siz də qadınlarınızdan ötrü libas kimisiniz. (Ər-arvad bir-biriləri ilə əlaqədə olub, qucaqlaşıb, bədənləri bir-birinə toxunduğu üçün Allah-Təala onları bir-birindən ötrü libasa bənzədir). (عَلِمَ اللّٰهُ اَنَّكُمْ كُنْتُمْ تَخْتَانُونَ اَنْفُسَكُمْ) - Allah-Təala buna agahdır ki, əlbəttə, siz xeyir əməl baxımından özünüzə xəyanət edib, xeyir əməlin həzz və nəsibini azaldırsınız. O səbəbdən Allah-Təala gecə vaxtı cinsi əlaqəni sizə halal etdi. Ta ki özünüzə xəyanət etməyəsiniz. (فَتَابَ عَلَيْكُمْ وَعَفَا عَنْكُمْ) - tövbə etdiniz, Allah-Təala da tövbənizi qəbul edib, əfv edib günahınızı bağışladı. (فَالْئٰنَ بَاشِرُوهُنَّ) - indi oruc gecələrində xanımlarınıza yönəlib əlaqədə olun. (وَابْتَغُوا مَا كَتَبَ اللّٰهُ لَكُمْ) - əlaqə zamanı o yeri ki Allah-Təala sizin üçün hökm verib halal edibdir, o yeri istəyib, o yerdən yaxınlaşın (arxadan yox, öndən yaxınlaşın) - bu ayə buna dəlildir ki, kişinin öz qadını ilə arxadan əlaqədə olması haramdır). (وَكُلُوا وَاشْرَبُوا) - ramazan gecələrində yeyin, için, (حَتّٰى يَتَبَيَّنَ لَكُمُ الْخَيْطُ الْاَبْيَضُ) – ta ki ağ sap** (sübh) **sizdən ötrü aşkar olsun, (مِنَ الْخَيْطِ الْاَسْوَدِ مِنَ الْفَجْرِ) - qara sapdan** (gecədən). (Ağ sapın qara sapdan fərqlənməsi sübhün açılması deməkdir). **(Allah-Təala sübhü ağ sapa, gecəni qara sapa oxşadır). Ədiy ibn Hatəm deyir: "Elə ki bu ayə nazil oldu, hər dəfə yatanda iki iplik götürüb başımın altında qoyurdum. Hər vaxt yuxudan duranda götürüb o ağ və qara ipliklərə baxırdım. Məlum olmurdu ki, hansı ağ, hansı qaradır. Səhər açılanda peyğəmbərin hüzuruna gedib, gecəki hadisəni ona danışdım. Hz. Peyğəmbər təbəssüm edib buyurdu: ağ sap, qara sap sübhün ağlığıyla, gecənin qaranlığından ibarətdir"** (Buxari, Təfsir 2/29, Savm 16; Müslüm, Sıyam 33)**. (ثُمَّ اَتِمُّوا الصِّيَامَ اِلَى الَّيْلِ) - sübh aşkar olan-**

وَلَا تُبَاشِرُوهُنَّ وَاَنْتُمْ عَاكِفُونَ فِي الْمَسَاجِدِ تِلْكَ حُدُودُ اللّٰهِ فَلَا تَقْرَبُوهَا كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ اٰيَاتِهِ لِلنَّاسِ لَعَلَّهُمْ يَتَّقُونَ﴿١٨٧﴾ وَلَا تَاْكُلُوٓا اَمْوَالَكُمْ بَيْنَكُمْ بِالْبَاطِلِ وَتُدْلُوا بِهَآ اِلَى الْحُكَّامِ لِتَاْكُلُوا فَرِيقًا مِنْ اَمْوَالِ النَّاسِ بِالْاِثْمِ وَاَنْتُمْ تَعْلَمُونَ﴿١٨٨﴾ يَسْـَٔلُونَكَ عَنِ الْاَهِلَّةِ قُلْ هِيَ مَوَاقِيتُ لِلنَّاسِ وَالْحَجِّ

---

**dan sonra ta gecəyə kimi orucu tutub tamamlayın. (وَلَا تُبَاشِرُوهُنَّ وَاَنْتُمْ عَاكِفُونَ فِي الْمَسَاجِدِ) - məscidlərdə "etikaf"* etdiyiniz halda** (yəni təkcə ibadət üçün oturduğunuz halda) **qadınlarınızla əlaqədə olmaq üçün onlara yaxınlaşmayın. (Əgər "etikaf" ramazan ayında olsa, gündüz qadınlardan kənar olan kimi, gecələr də kənar olmaq lazımdır. Əgər ramazandan başqa, vaxt olsa, gecə-gündüz qadınlardan kənar olmaq lazımdır. Çünki etikaf zamanı qadınlara yaxınlaşmaq haramdır. (تِلْكَ حُدُودُ اللّٰهِ) - bu hökmlər ki qeyd olundu, bunlar Allah-Təalanın qoyduğu hədlərdir, onları aşmaq olmaz. (فَلَا تَقْرَبُوهَا) - Allah-Təalanın təyin etdiyi hədləri və qanunları qoruyub, onların xilafını etməyin.**

*(* **Qeyd:** Etikaf xüsusi bir ibadətdir. Onun xüsusiyyəti belədir: bir kəs ramazan ayında, ya da başqa vaxt nəzir tutsa ki, 3 gün, ya da 3 gündən artıq gedib filan məsciddə ibadətlə məşğul olum, bu ibadətin adına "etikaf" deyilir. Bu ibadət gərək məsciddə olsun. Ramazan ayında, ya da başqa vaxt olsa, etikaf edən şəxs gərək oruclu olsun, oruclu olmasa bu ibadət dürüst deyildir. 3 gündən az da olsa, bu nəzir doğru olmaz (Təbərsi, II/505)).*

**(كَذٰلِكَ) - necə ki burada sizdən ötrü oruc hökmünü bəyan edir. Habelə (يُبَيِّنُ اللّٰهُ اٰيَاتِهِ لِلنَّاسِ) - Allah-Təala din və şəriət ehkamını xalqdan ötrü bəyan edir. (لَعَلَّهُمْ يَتَّقُون) - əlbəttə, gərək xalq haram olan şeylərdən çəkinsin ki, Allahın əzabından nicat tapsın.**

**188) (وَلَا تَاْكُلُوٓا اَمْوَالَكُمْ بَيْنَكُمْ بِالْبَاطِلِ) - öz aranızda nahaq və batil yollarla** (hansı ki Allah-Təala caiz etməyib və şəriətdə varid olmayıb)**, öz mallarınızı yeməyin. (Məsələn, faiz, qəsb, oğurluq və bunlardan başqa haram yollarla), (وَتُدْلُوا بِهَآ اِلَى الْحُكَّامِ) – var-dövlət davasında hakimlərə yönəlməyin, (لِتَاْكُلُوا فَرِيقًا مِنْ اَمْوَالِ النَّاسِ بِالْاِثْمِ) – ta ki hakimlərə yönəlməklə xalqın malından günah yoluyla bir qədər yeyəsiniz. ( وَاَنْتُمْ تَعْلَمُونَ) halbuki siz agahsınız ki, xalqın malını yemək günah və haramdır.**

**189) (يَسْـَٔلُونَكَ عَنِ الْاَهِلَّةِ) -** (ey Məhəmməd)**, səndən hər bir ayın əvvəlində nəyə görə o böyüklükdəki ayın ip kimi nazik** (hilal şəklində) **olub** (doğub) **yenidən bədrləndiyini soruşurlar. (Bu sualı verənlər ənsardan iki nəfər avam şəxs olub, biri Muaz ibn Cəbəl, o biri Sələbə ibn Ğunm idi. Ayın bu xüsusiyyətlərini onlara izah etmək çətin olduğundan onlara belə cavab verdi: (قُلْ هِيَ مَوَاقِيتُ لِلنَّاسِ وَالْحَجِّ) -** (ey Məhəmməd)**, sual verənlərə de ki, o aylar insanların hər bir əməlindən ötrü əlamətdir. Onunla vaxtı müəyyən**

وَلَيْسَ الْبِرُّ بِاَنْ تَاْتُوا الْبُيُوتَ مِنْ ظُهُورِهَا وَلٰكِنَّ الْبِرَّ مَنِ اتَّقٰىۚ وَاْتُوا الْبُيُوتَ مِنْ اَبْوَابِهَاۖ وَاتَّقُوا اللّٰهَ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿١٨٩﴾ وَقَاتِلُوا فِي سَبِيلِ اللّٰهِ الَّذِينَ يُقَاتِلُونَكُمْ وَلَا تَعْتَدُواۜ اِنَّ اللّٰهَ لَا يُحِبُّ الْمُعْتَدِينَ﴿١٩٠﴾ وَاقْتُلُوهُمْ حَيْثُ ثَقِفْتُمُوهُمْ وَاَخْرِجُوهُمْ مِنْ حَيْثُ اَخْرَجُوكُمْ

---

**edərlər. Bir də həccin vaxtını bildirməkdən ötrü əlamətdir. (Ey sual verənlər, məlumdur ki, Allah-Təala hər bir feili əmələ gətirəndə hikmət və məsləhət üzrə onu əmələ gətirər. Bu sual qalsın, çünki ayın bədr və hilal olmasının səbəbini siz dərk edə bilməzsiniz. Baxın o əməllərə ki, siz onu edirsiniz. Görün ağıl sahibləri o cür şeylər edərmi? O əməl budur. Siz həcdən ötrü ehram bağlayanda evə, ya da çadıra qapıdan daxil olmayıb, evə damdan, çadıra arxa tərəfdən daxil olub bunu özünüzdən ötrü xeyir bir əməl hesab edirsiniz. Ənsardan bir qrup həcdən ötrü ehram bağlayanda evə damdan, çadıra da arxa tərəfdən daxil olurdular, halbuki bu, xeyir bir əməl deyildir. Siz belə şeyləri soruşun, amma siz bunu qoyub ayın həqiqətini soruşursunuz. O əməllərinizin cavabı budur: (وَلَيْسَ الْبِرُّ بِاَنْ تَاْتُوا الْبُيُوتَ مِنْ ظُهُورِهَا) - xeyir əməl o deyil ki, evə, ya da mənzilə daxil olanda evin, ya da mənzilin arxa tərəfindən, ya da damın üstündən daxil olasınız. (وَلٰكِنَّ الْبِرَّ مَنِ اتَّقٰى) - əksinə, xeyir əməl odur ki, şəxs Allah-Təalanın haram etdiyi şeylərdən çəkinsin. (وَاْتُوا الْبُيُوتَ مِنْ اَبْوَابِهَا) - evlərə qapılardan daxil olun. (وَاتَّقُوا اللّٰهَ لَعَلَّكُمْ تُفْلِحُونَ) - Allah-Təaladan qorxub, ümidvar olun ki, qiyamət günündə nicat tapan şəxslərdən olasınız.** (Bundan sonra qeyd olunan bir neçə ayə Məkkə əhliylə savaşmaq haqqında nazil olubdur. Hz. Peyğəmbər Məkkə fəthindən qabaq Mədinədə ehram bağlayıb Kəbəni ziyarət məqsədi ilə səhabələri ilə birlikdə Mədinədən Məkkəyə yönəldi. Hüdeybiyyə adlı yerə çatdılar. Orada müşriklər Hz. Peyğəmbərin Məkkəyə daxil olmasına mane oldular. Dedilər: "Bu il qayıt, gələn il gələrsən, biz Məkkədən çıxıb, üç gün səndən ötrü Məkkəni boş qoyarıq". Hz. Peyğəmbər oradan qayıtdı. İkinci il peyğəmbər yenidən Məkkəyə gedəndə səhabələr qorxdular ki, bəlkə, keçən il kimi onlara mane oldular. O vaxt gərək savaşaydılar. Bu barədə aşağıdakı bir neçə ayə nazil oldu).

**190) (وَقَاتِلُوا فِي سَبِيلِ اللّٰهِ)** – (ey möminlər), **Allah-Təala yolunda cihad edin. (الَّذِينَ يُقَاتِلُونَكُمْ) - o şəxslər ki sizinlə savaşıb sizə Məkkəyə daxil olmaqda mane olurlar. (وَلَا تَعْتَدُوا) - həddi aşmayıb, zülmü tərk edin. O şəxslər ki sizinlə savaşmırlar, siz onlarla savaşa başlamayın. (اِنَّ اللّٰهَ لَا يُحِبُّ الْمُعْتَدِينَ) - həqiqətən, Allah-Təala həddi aşıb, zalım olan şəxsləri sevməz.**

**191) (وَاقْتُلُوهُمْ) - Məkkə əhlindən o şəxslər ki sizinlə savaşa başlayır, onları qətlə yetirin, (حَيْثُ ثَقِفْتُمُوهُمْ) - onları harda tapsanız, (وَاَخْرِجُوهُمْ مِنْ حَيْثُ اَخْرَجُوكُمْ) – hardan ki sizi çıxardıblar, siz də onları oradan çıxarın.** (Necə

وَالْفِتْنَةُ اَشَدُّ مِنَ الْقَتْلِۚ وَلَا تُقَاتِلُوهُمْ عِنْدَ الْمَسْجِدِ الْحَرَامِ حَتّٰى يُقَاتِلُوكُمْ فِيهِۚ فَاِنْ قَاتَلُوكُمْ فَاقْتُلُوهُمْۜ
كَذٰلِكَ جَزَٓاءُ الْكَافِرِينَ﴿١٩١﴾ فَاِنِ انْتَهَوْا فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ﴿١٩٢﴾ وَقَاتِلُوهُمْ حَتّٰى لَا تَكُونَ فِتْنَةٌ
وَيَكُونَ الدِّينُ لِلّٰهِۜ فَاِنِ انْتَهَوْا فَلَا عُدْوَانَ اِلَّا عَلَى الظَّالِمِينَ ﴿١٩٣﴾ اَلشَّهْرُ الْحَرَامُ بِالشَّهْرِ الْحَرَامِ

---

ki sizi Məkkədən çıxartdılar, siz də onlara qalib olanda Məkkədən onları çıxardın). **(وَالْفِتْنَةُ اَشَدُّ مِنَ الْقَتْلِ) - vətəndən çıxarılmaq bəlası onlar üçün qətl edilməkdən daha şiddətlidir.** (Bu kəlam vətənin əziz və sevimli olmasına işarədir. Bir şey ki, qətl edilməkdən artıq olsun, onun müsibəti gör necə olacaqdır, bu müsibəti Hz. Peyğəmbər özü dərk etdiyindən buyurdu: "Vətəni sevmək imandan bir cüzdür"). **(وَلَا تُقَاتِلُوهُمْ عِنْدَ الْمَسْجِدِ الْحَرَامِ) - siz Məkkə əhliylə Məscidül-həramın yanında və onun ətrafında savaşmayın,** (Çünki Məscidül-həramda və onun ətrafında savaşmaq haramdır). **(حَتّٰى يُقَاتِلُوكُمْ فِيهِ) – ta ki onlar sizinlə Məscidül-həramın yanında savaşmağa başlayıncaya qədər. (فَاِنْ قَاتَلُوكُمْ) - əgər onlar sizinlə savaşmağa başlasalar, (فَاقْتُلُوهُمْ) - siz də onlar ilə savaşıb onları qətlə yetirin, (كَذٰلِكَ جَزَٓاءُ الْكَافِرِينَ) - kafir olan Məkkə əhlinin cəzası budur, gərək onları qətlə yetirəsiniz.**

**192) (فَاِنِ انْتَهَوْا) - (əgər Məkkə əhli şirkdən və sizinlə savaşmaqdan kənar olub tövbə etsələr, (فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ) - həqiqətən, Allah-Təala onların tövbəsini qəbul edib, onlara rəhm edib günahlarını bağışlayandır.**

**193) (وَقَاتِلُوهُمْ) - elə ki onlar sizinlə savaşdılar, siz də onlarla savaşın, (حَتّٰى لَا تَكُونَ فِتْنَةٌ) – ta ki Allah-Təalaya şərik qoşmağı dayandırana qədər, (وَيَكُونَ الدِّينُ لِلّٰهِ) - və din ancaq Allah-Təaladan ötrü olub, onda şirk olmayana qədər. (فَاِنِ انْتَهَوْا) - əgər tövbə edib şirkdən kənar olsalar, (فَلَا عُدْوَانَ اِلَّا عَلَى الظَّالِمِينَ) - o zaman zalım və müşriklərdən başqa şəxslərə qarşı ədavət və düşmənçilik yoxdur.** (İslam dinində onlardan başqası ilə ədavət saxlamaq caiz deyildir. O ildə ki Hz. Peyğəmbərə Məkkəyə daxil olmaqda mane oldular, Hüdeybiyyədən qayıtdı, bu hadisə zülqədə ayında olmuşdu. Ümrənin qəzasından ötrü yenidən Məkkəyə gedəndə yenə zülqədə ayı idi. Dörd aya (zülqədə, zülhiccə, məhərrəm, rəcəb) haram aylar deyilir ki, onlarda savaşmaq haramdır. Hətta cahiliyyə zamanında da bu dörd ayın ehtiramını qoruyub bu aylarda savaşmazdılar. Amma Məkkə əhli zülqədə ayının ehtiramını pozub, peyğəmbərin Məkkəyə daxil olmasına mane oldu. Allah-Təala onların bu əməlinin müqabilində (ümrənin qəzası vaxtı) zülqədə ayında peyğəmbərə onlarla savaşmağa izin verdi. Necə ki sıradakı ayədə bəyan edir).

**194) (اَلشَّهْرُ الْحَرَامُ بِالشَّهْرِ الْحَرَامِ)** – (necə ki Məkkə əhli keçən il haram ayın (zülqədənin) ehtiramını pozub, sizin Məkkəyə daxil olmanıza mane oldular, habelə sizə də izin verilir ki, əgər bu zülqədə ayında sizinlə savaşsalar, siz də onlarla savaşasınız). **Bu haram ay** (keçən ildəki) **o haram aya müqabil**

**وَالْحُرُمَاتُ قِصَاصٌۜ فَمَنِ اعْتَدٰى عَلَيْكُمْ فَاعْتَدُوا عَلَيْهِ بِمِثْلِ مَا اعْتَدٰى عَلَيْكُمْ وَاتَّقُوا اللّٰهَ وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ مَعَ الْمُتَّق۪ينَ ﴿١٩٤﴾ وَاَنْفِقُوا ف۪ي سَب۪يلِ اللّٰهِ وَلَا تُلْقُوا بِاَيْد۪يكُمْ اِلَى التَّهْلُكَةِۚ وَاَحْسِنُواۚ اِنَّ اللّٰهَ يُحِبُّ الْمُحْسِن۪ينَ ﴿١٩٥﴾ وَاَتِمُّوا الْحَجَّ وَالْعُمْرَةَ لِلّٰهِۜ فَاِنْ اُحْصِرْتُمْ**

---

**olsun. (وَالْحُرُمَاتُ قِصَاصٌ) - hər bir haram şeydə qisas vardır, keçənilki zülqədənin qisasını bu il onlardan ala bilərsiniz. (فَمَنِ اعْتَدٰى عَلَيْكُمْ) - kim ki həddi aşıb sizə zülm edib sizinlə savaşsa, (فَاعْتَدُوا عَلَيْهِ) - siz də ona əvəz edin, (بِمِثْلِ مَا اعْتَدٰى عَلَيْكُمْ) - o zülmün eynisi qədər ki sizə ediblər. (وَاتَّقُوا اللّٰهَ) - Allah-Təaladan qorxun ki, sizə olunan zülmdən artıq onlara* zülm etməyəsiniz. (وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ مَعَ الْمُتَّق۪ينَ) - bunu bilin ki, həqiqətən, Allah-Təala müttəqi olan şəxslərlə bir olub həmişə onlara köməkdir.**

*(****Qeyd:*** “Ey Qurani-Şərifə insaf gözüylə baxmayanlar, bir göz açıb bu ayəyə nəzər salın, Məkkənin əhli ki tamamilə müşrik olmasına baxmayaraq, Allah-Təala onlara zülmü rəva görmür. Buyurur: “Sizə nə qədər zülm etsələr və sizdən nə qədər qətlə yetirsələr, siz də o qədər onun əvəzini edin”. Diqqət edin, islamın nə gözəl qanunları var, Allahın rəhməti o müsəlmanlardan kənar olsun ki, bu mübarək ayəyə əməl etməyib, öz din qardaşlarına zülmü rəva görürlər).*

**195) (وَاَنْفِقُوا ف۪ي سَب۪يلِ اللّٰهِ) - Allah-Təala yolunda malınızı xərcləyib, ehsan edin və onlardan böyüyü Allah-Təala yolunda** cihad etməkdə mal xərcləməkdir. (وَلَا تُلْقُوا بِاَيْد۪يكُمْ اِلَى التَّهْلُكَةِ) - öz əllərinizlə özünüzü fəlakətə salıb xərcləməyi və ehsanı tərk etməyin, ehsanı tərk etmək insanın həlak olub, Allah-Təalanın rəhmətindən uzaq olmasına baisdir. (وَاَحْسِنُوا) - o yerlərdə ehsan edin ki, orada ehsan etmək lazımdır. (اِنَّ اللّٰهَ يُحِبُّ الْمُحْسِن۪ينَ) - həqiqətən, Allah-Təala ehsan edən şəxsləri sevər.**

*(****Qeyd:*** Cihad iki növdür: birincisi – “cihadı-əkbər” (böyük cihad), o birisi “cihadı-əsğər” (kiçik cihad), kiçik cihad din yolunda savaşmaq və canından keçməkdir, böyük cihad isə nəfsani arzulara zidd getməkdir, nəfsə çətin gələn ən böyük iş din və ümmət yolunda malından keçməkdir. Necə ki Allah-Təala buyurur: “Xərcləyin, gərək varlı müsəlmanlar bir-birilərinin yardımı ilə məscidlər və yoxsullar evi, onlardan ötrü məktəb və mədrəsələr, uşaqların təhsili üçün zamanın şərtlərinə uyğun nə lazımdırsa etsinlər. Elm öyrənməkdən daha üstün nə ola bilər?” Hz. Peyğəmbərimiz (s.ə.s) buyurur: “Beşikdən qəbrə kimi elm öyrənin”).*

**196) (وَاَتِمُّوا الْحَجَّ وَالْعُمْرَةَ لِلّٰهِ)** – (o vaxt ki həcc, ya da ümrədən ötrü ehram bağladınız), **həcci və ümrəni kamil şəkildə hər bir şəraiti ilə Allah-Təaladan ötrü tamamlayın.** (Həcc, ya da ümrəyə ehram bağlayan şəxsdən ötrü onun əməlini tamamlamamış ehramdan çıxmaq caiz deyildir. Həcc və ümrənin təfsilatı bundan sonra gələn 196-cı ayənin təfsirində bəyan olunacaqdır). **(فَاِنْ اُحْصِرْتُمْ) –əgər** (ehrama daxil olandan sonra həcc, ya da ümrəni tamamlaya bilməsəniz)

فَمَا اسْتَيْسَرَ مِنَ الْهَدْيِۚ وَلَا تَحْلِقُوا رُؤُسَكُمْ حَتّٰى يَبْلُغَ الْهَدْيُ مَحِلَّهُۜ فَمَنْ كَانَ مِنْكُمْ مَرِيضًا اَوْ بِهٖٓ اَذًى مِنْ رَاْسِهٖ فَفِدْيَةٌ مِنْ صِيَامٍ اَوْ صَدَقَةٍ اَوْ نُسُكٍۚ فَاِذَٓا اَمِنْتُمْ۠ فَمَنْ تَمَتَّعَ بِالْعُمْرَةِ اِلَى الْحَجِّ فَمَا اسْتَيْسَرَ مِنَ الْهَدْيِۚ فَمَنْ لَمْ يَجِدْ فَصِيَامُ ثَلٰثَةِ اَيَّامٍ فِي الْحَجِّ وَسَبْعَةٍ اِذَا رَجَعْتُمْ تِلْكَ عَشَرَةٌ كَامِلَةٌۜ ذٰلِكَ لِمَنْ لَمْ يَكُنْ اَهْلُهُ حَاضِرِي الْمَسْجِدِ الْحَرَامِۜ

---

**qadağan olunsanız,** (məsələn, səfər əsnasında xəstələnsəniz, Məkkəyə daxil ola bilməsəniz, ya da düşmən sizin Məkkəyə daxil olmanıza mane olsa, o vaxt həmin yerdə ehramdan çıxa bilərsiniz. Amma ondan ötrü gərək Məkkəyə bir heyvan hədiyyə göndərəsiniz). **(فَمَا اسْتَيْسَرَ مِنَ الْهَدْيِ) - sizdən ötrü hansı heyvanı hədiyyə göndərmək mümkün olsa,** (dəvə, inək, ya da qoyun) **gərək onu göndərəsiniz, Hərəmdə* kəsilsin, nə qədər ki, o heyvan kəsilməyibdir, ehramdan çıxmaq caiz deyildir.**

*(***Qeyd:** Məkkənin xaricində əlamətlər vardır, o əlamətləri keçəndən sonra o bölgə haram bölgədir).*

**(وَلَا تَحْلِقُوا رُؤُسَكُمْ) - başınızı qırxıb ehramdan çıxmayın, (حَتّٰى يَبْلُغَ الْهَدْيُ مَحِلَّهُ) – ta o vaxta qədər ki, hədiyyə göndərdiyiniz o heyvan kəsilmə yerinə çatsın. Nə vaxt ki o hədiyyə oraya çatıb kəsildi, siz də həmin yerdə ki, sizdən ötrü getmək qadağan olunubdur, ehramdan çıxa bilərsiniz. (فَمَنْ كَانَ مِنْكُمْ مَرِيضًا) - sizdən kim ki həcc zamanında ehramda olan halda naxoş olub başını qırxmağa ehtiyacı olsa, (اَوْ بِهٖٓ اَذًى مِنْ رَاْسِهٖ) – ya da başında ağrı olub əziyyət çəksə, (bu iki halda başını qırxa bilər, amma əvəzində gərək kəffarə versin). (فَفِدْيَةٌ مِنْ صِيَامٍ) - o baş qırxmağın fidyə və kəffarəsindən ötrü 3 gün oruc tutar. (اَوْ صَدَقَةٍ) – ya da 6 nəfər yoxsula yemək verər. (اَوْ نُسُكٍ) – ya da bir qoyun kəsər, bu 3 şeydən biri baş qırxmağın kəffarəsidir. (فَاِذَٓا اَمِنْتُمْ) – nə vaxt ki əmin-amanlıqda oldunuz, Məkkəyə daxil olmaqda sizə bir mane olmadı, (فَمَنْ تَمَتَّعَ بِالْعُمْرَةِ اِلَى الْحَجِّ) - kim ki ümrə ilə Allah-Təalaya yaxınlaşıb, Onun savabından mənfəət əldə etsə, həcc vaxtı hazır olana kimi,** (yəni miqatdan, ümrədən ötrü ehram bağlasa, Məkkəyə daxil olub Kəbəni tavaf edib Səfa ilə Mərvə arasında 7 dəfə gedib-gəlsə, ondan sonra baş, ya da saqqal tükündən bir qədər kəssə, buna ümrə deyilir). **(فَمَا اسْتَيْسَرَ مِنَ الْهَدْيِ) - ümrədən çıxandan sonra qurbanlıq* üçün hansı heyvan mümkün olsa, gərək o heyvanı kəssin, buna "hədyi-mütə"** (Allah üçün kəffarət verilən qurban) **deyilir. (فَمَنْ لَمْ يَجِدْ) - kim ki ümrədən ötrü kəsməyə qurbanlıq tapmasa, (فَصِيَامُ ثَلٰثَةِ اَيَّامٍ فِي الْحَجِّ) - onun əvəzində 3 gün oruc tutsun.** (Həcc günlərində zülhiccə ayının 7, 8, 9-cu günlərində), **(وَسَبْعَةٍ اِذَا رَجَعْتُمْ) – o zaman ki Məkkədən öz vətəninizə qayıtdınız, gərək 7 gün oruc tutasınız. (تِلْكَ عَشَرَةٌ كَامِلَةٌ) - bu üç gün və yeddi gün oruc birlikdə tam on gün edər. Kim ki ümrədən ötrü kəsməyə heyvan tapmasa, onun əvəzində gərək 10 gün oruc tutsun. (ذٰلِكَ) - bu "ümreyi-təməttö"nün vacib olması, ( لِمَنْ لَمْ يَكُنْ اَهْلُهُ حَاضِرِي الْمَسْجِدِ الْحَرَامِ)**

وَاتَّقُوا اللّٰهَ وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ شَد۪يدُ الْعِقَابِ ﴿١٩٦﴾ اَلْحَجُّ اَشْهُرٌ مَعْلُومَاتٌ فَمَنْ فَرَضَ ف۪يهِنَّ الْحَجَّ فَلَا رَفَثَ وَلَا فُسُوقَ

---

**- o şəxsdən ötrüdür ki, onun ailəsi Məkkədə və ətrafında məskun deyildir. (Kim Məkkədən 12 mil uzaqlıqda məskun olsa, ona "ümreyi-təməttö" vacibdir. (وَاتَّقُوا اللّٰهَ) - Allah-Təaladan qorxub, həccin ehkamını mühafizə edin. (وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ شَد۪يدُ الْعِقَابِ) - bilin ki, həqiqətən, Allah-Təala onun itaətindən çıxan şəxsə şiddətli əzab edəndir.**

*(*Qeyd: Müsəlmanlar arasında qurban kəsmək ümrənin əməllərindən hesab edilmir, görəsən, belə bir hökmə əməl edilməməsinin səbəbi nədir?)*

**197) (اَلْحَجُّ اَشْهُرٌ مَعْلُومَاتٌ) – həccin vaxtı məlum olan bir neçə aydır ki, onlara şübhə yoxdur** (və o aylardan (şəvval, zülqədə, on gün zülhiccədən) başqa aylarda həcc etmək doğru olmaz. Həccdən məqsəd həm ümrə, həm də həccin özüdür, amma ümrənin əməli həccin əməlindən əvvəldir, həcc və ümrənin əməli müxtəsər şəkildə belədir: həccə gedən şəxs elə ki "miqata"* yetişdi, miqatdan, ümrədən ötrü ehram bağlayar, Məkkəyə daxil olandan sonra əvvəl Kəbəni 7 dəfə tavaf edər, ondan sonra iki rükət tavaf namazını "məqami-İbrahim"in arxa tərəfində qılar, ondan sonra Səfa ilə Mərvə arasında 7 dəfə gedib-gəlib, başının, ya da saqqalının tükündən kəsdirib, ehramdan çıxar. Öz libaslarını geyər və o şeylər ki ona ehramda haram idi, o vaxt ona halal olar. Ondan sonra səbir edər. Elə ki zülhiccənin 8-ci günü oldu, o gün Məkkədə Zəmzəm suyunda qüsl edib "həcci-təməttö"dən ötrü ehram bağlayıb Məkkədən çıxar. Zülhiccənin 9-cu günü əvvəlcə günortadan günəşin batmasına qədər Ərəfat çölündə durar, ondan sonra "Məşərül-haram"a (Müzdəlifədəki Kuzah dağı) gəlib Qurban bayramı günü burada durar. Ondan sonra Minaya gəlib şeytanı daşlayıb qurban kəsər. Başını qırxar, ondan sonra Məkkəyə gəlib həcc tavafı edər. İki rükət tavaf namazı qılıb Səfa ilə Mərvə arasında 7 dəfə gedib-gəlib, ondan sonra Minaya qayıdar. Orada gecəni qalıb ondan sonra çıxıb gedər. Həcc və ümrənin müxtəsər qeyd olunan bu əməllərinin hamısı vacibdir. Bunlardan əlavə, şiə məzhəbi "tavafı-nisa" (qadın tavafı) və onun iki rükət namazını da vacib sayır (Tusi, Təhzib, V/28; İstibsar, II/228)).

*(*Qeyd: "Miqat" Məkkənin xaricində o yerlərdir ki, onlara əlamət qoyublar, Məkkəyə gedən şəxs ümrədən ötrü gərək o miqatlarda ehram bağlasın, ətraf yerlərdən gələn hər kəsdən ötrü Məkkənin hər bir tərəfində bir "miqat" vardır. Həccə gedən şəxsdən ötrü o miqatlardan ehramsız keçmək caiz deyildir).*

**(فَمَنْ فَرَضَ ف۪يهِنَّ الْحَجَّ) - kim bu qeyd olunan aylarda ümrə, ya da həccin əməllərini özünə vacib etsə, (yəni niyyət edib ehram bağlasa, o şəxs daha ehramdan çıxa bilməz və bəzi şeylər ona haramdır), (فَلَا رَفَثَ) – cinsi əlaqə haramdır, ( وَلَا فُسُوق) – söyüş söymək və pis sözlər danışmaq haramdır.**

وَلَا جِدَالَ فِي الْحَجِّ ۗ وَمَا تَفْعَلُوا مِنْ خَيْرٍ يَعْلَمْهُ اللّٰهُ ۗ وَتَزَوَّدُوا فَاِنَّ خَيْرَ الزَّادِ التَّقْوٰى ۘ وَاتَّقُونِ يَٓا اُو۬لِي الْاَلْبَابِ ﴿١٩٧﴾ لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَنْ تَبْتَغُوا فَضْلًا مِنْ رَبِّكُمْ ۜ فَاِذَٓا اَفَضْتُمْ مِنْ عَرَفَاتٍ فَاذْكُرُوا اللّٰهَ عِنْدَ الْمَشْعَرِ الْحَرَامِ ۖ وَاذْكُرُوهُ كَمَا هَدٰيكُمْ ۚ

---

**(وَلَا جِدَالَ) – bir-biri ilə dava-dalaş etmək haramdır. (فِي الْحَجِّ ) – həcc, ya da ümrədən ötrü ehramda olan zaman bu qeyd olunanların hamısı haramdır. (وَمَا تَفْعَلُوا مِنْ خَيْرٍ يَعْلَمْهُ اللّٰهُ) - o pis əməllərin əvəzinə nə xeyir əməl etsəniz, Allah-Təala onlara agahdır. Əlbəttə, sizə mükafat verəcəkdir. (وَتَزَوَّدُوا) - axirətdən ötrü lazım olan şeylərdən tədarük edin. (فَاِنَّ خَيْرَ الزَّادِ التَّقْوٰى) - həqiqətən, axirət tədarükünün ən yaxşısı təqva və pəhriz saxlamaqdır. (وَاتَّقُونِ يَٓا اُو۬لِي الْاَلْبَابِ) - ey ağıl sahibləri, mənim əzabımdan qorxun,** (həcdə, ya da başqa yerlərdə pis və qəbih əməlləri tərk edin. Nə zaman həcc ayları başlasa, ərəblərin əksəriyyəti ticarəti tərk edərdi. Kim ticarət etsəydi, ona eyib sayardılar. Allah-Təala sıradakı ayədə əvvəlcə onlardan ötrü ticarətin caiz olduğunu bəyan edir. Ondan sonra həcc ehkamını bəyan edir).

**198) ( لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ) - sizə bunda heç bir günah yoxdur ki, (اَنْ تَبْتَغُوا فَضْلًا مِنْ رَبِّكُمْ) – həcc zamanında * ticarət edib öz rəbbiniz Allah-Təalanın lütf və rəhmətindən ruzi tələb edəsiniz.**

*(****Qeyd:*** Ticarət və ruzi tələb etmək həccə zidd deyildir, Allah-Təala ticarəti tərk etməyi bizə əmr etməyibdir, əgər ticarət olmasa, həccə getmək necə mümkün olar? Həccin özündə həm dünya, həm də axirət mənfəəti var. İslam ümməti həccin din və ümmətə aid olan mənfəətini unudub, onun zahiri xüsusiyyətlərinə diqqət edir. Şəriətin məqsədi nədir? Allah-Təalanı zikr edib təzim və təqdis etmək Ərəfat vadisində, Məscidül-həramda, ya da şəxsin öz evində, dünyanın hansı yerində olmuş olsa, bərabər və eynidir. Bəs müəyyən bir vaxtda, xüsusi bir məkanda toplanıb Allah-Təalanı zikr etməkdə şəriət sahibinin başqa bir məqsədi vardır. O məqsəd əksər müsəlmanlara gizli qalmışdır, amma diqqətli olanlara gizli deyildir. Lakin bu çoxluqdakı İslam ümmətinin arasında az sayda olan şəxslərin dərk etdiyi mətləbin rəvac tapması müşkül iş olduğundan müqəddəs şəriət sahibinin əsl məqsədi gizli qalıb zay olubdur. Gərək bu zamanda islam dini üçün ağlaşma qurub, yaş yerinə gözlərdən qan axsın. Bu zamanda bütün islam ümməti böyük bir cəhalətə düçar olduğundan hər əmrin həqiqətini bəyan etmək mümkün olmur, bəyan edən şəxslər də böyük xətərlərə düçar olurlar. Nə gözəl demiş Mövlana Cəlaləddin Rumi : Vaxt dardır, fəqət xalqın xətri və anlayışı da, vaxtdan yüz dəfə daha dardır! fəqət oğul, xalqın anlayışı da vaxtdan daha dar).*

(Ondan sonra Allah-Təala hacılara xitab edir:) **(فَاِذَٓا اَفَضْتُمْ مِنْ عَرَفَاتٍ) – nə zaman ki Ərəfatdan qayıtdınız, o vaxt Məşərül-harama gəlin. (فَاذْكُرُوا اللّٰهَ عِنْدَ الْمَشْعَرِ الْحَرَامِ) - Allah-Təalanı Məşərül-həramın* yanında zikr edin. (وَاذْكُرُوهُ كَمَا هَدٰيكُمْ) - necə ki Allah-Təala sizi islama hidayət edibdir, siz də Allah-**

وَاِنْ كُنْتُمْ مِنْ قَبْلِهٖ لَمِنَ الضَّٓالّ۪ينَ ﴿١٩٨﴾ ثُمَّ اَف۪يضُوا مِنْ حَيْثُ اَفَاضَ النَّاسُ وَاسْتَغْفِرُوا اللّٰهَۜ اِنَّ اللّٰهَ
غَفُورٌ رَح۪يمٌ ﴿١٩٩﴾ فَاِذَا قَضَيْتُمْ مَنَاسِكَكُمْ فَاذْكُرُوا اللّٰهَ كَذِكْرِكُمْ اٰبَٓاءَكُمْ اَوْ اَشَدَّ ذِكْرًاۜ فَمِنَ النَّاسِ مَنْ
يَقُولُ رَبَّنَٓا اٰتِنَا فِي الدُّنْيَا وَمَا لَهُ فِي الْاٰخِرَةِ مِنْ خَلَاقٍ ﴿٢٠٠﴾ وَمِنْهُمْ مَنْ يَقُولُ رَبَّنَٓا اٰتِنَا فِي الدُّنْيَا حَسَنَةً

---

**Təalanı zikr edin. (وَاِنْ كُنْتُمْ مِنْ قَبْلِهٖ لَمِنَ الضَّٓالّ۪ينَ) - əlbəttə, Allah-Təala sizi islama hidayət etmədən əvvəl cahil şəxslərdən idiniz.** (Gələn ayə Qüreyş camaatına xitabdır. Qüreyş camaatı təkəbbür və qürurlarından Ərəfatda və Məşərül-həramda sair camaatdan kənar düşüb qayıdanda onlardan ya əvvəl, ya da sonra qayıdardılar ki, başqalarına qarışmaq bizə layiq deyil).

*(*Qeyd: Məşərül-həram bir dağın adıdır. Hacılar gərək o dağın üzərində və ətrafında qurban bayramı gecəsi günəşin doğuşuna qədər qalıb Allah-Təalanı zikr edib, səhərə qədər şəriət sahibinin məqsədini təfəkkür etsinlər).*

**199) (ثُمَّ اَف۪يضُوا مِنْ حَيْثُ اَفَاضَ النَّاسُ) - Məşərül-həramda durandan sonra qurban bayramı günündə qayıdıb Minaya gedin, amma qayıdanda o yerdən və o yoldan gedin ki, insanların hamısı o yoldan gedir. Bir-birinizdən aralanmayın. İttifaq və birlik içində Minaya daxil olun.** (Görün Allah-Təala islam ümmətinə ittifaq və birlikdə olmağı necə əmr edir. Bu yolla həccin əsl məqsədini dərk etsinlər. İslama tərəqqi verən həmin birlikdir. Həccin bu zahiri əməllərinin batininə diqqət edib təfəkkür etmək lazımdır. Beyt: Dövlət olsa birliyimiz yüksələr, Dövlətsiz də, ancq nifaq yüksələr!). **(وَاسْتَغْفِرُوا اللّٰهَ) – bir-birinizdən ayrılmamaqdan ötrü Allah-Təaladan bağışlanmanızı istəyin.** (Camaatdan ayrılmaq böyük günahdır. Əfv edilməyə ehtiyacı vardır). **(اِنَّ اللّٰهَ غَفُورٌ رَح۪يمٌ) - həqiqətən, Allah-Təala tövbəkarları bağışlayıb rəhm edəndir.** (Cahiliyyə zamanında elə ki ərəblər həcdən ayrılırdılar, bir-biriləri ilə üzbəüz şeir oxuyub ata-babalarının fəzilətini qeyd edib, öyünərdilər. Allah-Təala növbəti ayədə bu lovğalanmağı tərk etməyi və onun əvəzində Allah-Təalanı zikr etməyi əmr edir. Bir-birinə qarşı öyünməkdən dava-dalaş və nifaq hasil olar. İslam ümməti arasında gərək nifaq yox, ittifaq olsun).

**200) (فَاِذَا قَضَيْتُمْ مَنَاسِكَكُمْ) - o zaman ki həcci tamamlayıb qurtardınız, (فَاذْكُرُوا اللّٰهَ) - Allah-Təalanı zikr edin, (كَذِكْرِكُمْ اٰبَٓاءَكُمْ اَوْ اَشَدَّ ذِكْرًا) - ata-babalarınızı zikr etdiyiniz kimi, bəlkə, ondan da artıq (فَمِنَ النَّاسِ مَنْ يَقُولُ)–insanlardan eləsi var ki, dua məqamında Allah-Təalanı zikr edəndə belə deyər:** (rabbəna ətina fid-dünya) **(رَبَّنَٓا اٰتِنَا فِي الدُّنْيَا) - ey mənim rəbbim, bizə nə verəcəksənsə, o şeyi elə bu dünyada ver, (وَمَا لَهُ فِي الْاٰخِرَةِ مِنْ خَلَاقٍ) - belə şəxslərdən ötrü axirət nemətlərindən heç bir nəsib və pay yoxdur.**

**201) (وَمِنْهُمْ مَنْ يَقُولُ) – insanlardan eləsi də var ki, dua məqamında belə deyər: (رَبَّنَٓا اٰتِنَا فِي الدُّنْيَا حَسَنَةً) - ey bizim rəbbimiz, dünyada bizə sənə qarşı asi**

وَفِي الْاٰخِرَةِ حَسَنَةً وَقِنَا عَذَابَ النَّارِ ﴿٢٠١﴾ اُولٰٓئِكَ لَهُمْ نَصِيبٌ مِمَّا كَسَبُواۜ وَاللّٰهُ سَرِيعُ الْحِسَابِ
﴿٢٠٢﴾ وَاذْكُرُوا اللّٰهَ فِيٓ اَيَّامٍ مَعْدُودَاتٍۜ فَمَنْ تَعَجَّلَ فِي يَوْمَيْنِ فَلَٓا اِثْمَ عَلَيْهِۚ وَمَنْ تَاَخَّرَ فَلَٓا اِثْمَ عَلَيْهِۙ لِمَنِ
اتَّقٰىۜ وَاتَّقُوا اللّٰهَ وَاعْلَمُوٓا اَنَّكُمْ اِلَيْهِ تُحْشَرُونَ ﴿٢٠٣﴾

---

**olmayacağımız gözəl nemətlərdən ver. (وَفِي الْاٰخِرَةِ حَسَنَةً) - axirətdə də yaxşı nemətlərdən bizə ver. (وَقِنَا عَذَابَ النَّارِ) - bizi cəhənnəm odunun əzabından qoru.**

**202) (اُولٰٓئِكَ لَهُمْ نَصِيبٌ مِمَّا كَسَبُوا) - bu duanı edən şəxslərdən ötrü dünyada qazandığı əməllərdən axirətdə də bir nəsib və pay vardır.** (Yəni axirət savabı əməlin qarşılığıdır. Əgər dünyada onlardan xeyir əməl meydana gəlsə, əlbəttə, o əməlin savabı axirətdə onlara veriləcəkdir). **(وَاللّٰهُ سَرِيعُ الْحِسَابِ) - Allah-Təala sürətlə* və tezliklə haqq-hesab edəndir. Sizin əməllərinizi qeyd edib, axirət günündə haqq-hesab məqamına gətirəcəkdir.**

*(****Qeyd:** *"Ey sağlam ağıl sahibi, bu ayəyə təfəkkürlə baxıb gör ki, Allah-Təala dünya hərisi olan şəxsi əvvəlcə necə məzəmmət edib axirət nemətlərindən binəsib elan edir, ikincisi, dünya və axirətin hər ikisini arzulayan şəxslərdən ötrü axirətdə necə əcr, savab, pay, nəsib təyin edir. Dünya və axirəti birlikdə istəyən şəxs Allah-Təala yanında sevimli şəxslərdən hesab olunur və bunun yanında Allah-Təala özünün haqq-hesab etmədə sürətli olduğunu qeyd edib, bizi qorxudur. Ta ki din yolunda dürüst olub, doğru rəftar edən şəxslərdən olaq. Çünki din və dünya bir-birindən ayrılan deyil. Din dünya ilə, dünya da din ilə abad olar. Hərçənd zahirdə müsəlman, batində dinsiz olan şəxslərdə dünya malının çox olduğu müşahidə olunur, lakin bizim dünya deməyimizdən məqsəd məhz dünya deyildir, əksinə, islam ümmətinin tərəqqisi və başqa xalqlara üstün olmasıdır. Bu təkcə var-dövlətlə olmaz, həm də dinə möhkəm sarılmaqla mümkündür, necə ki islamın ilk dövrlərində belə idi).*

**203) (وَاذْكُرُوا اللّٰهَ فِيٓ اَيَّامٍ مَعْدُودَاتٍ) - ey həccə gedənlər, Allah-Təalanı bir neçə sayılmış günlərdə** (3 gün - zülhiccənin 11, 12, 13-cü günlərində) **yada salıb zikr edin. Bu 3 gündə gərək bütün hacılar Minada toplanıb, Allah-Təalanı yada salıb, o birlik və ittifaqdan mənfəət əldə etsinlər, lakin insan iki gün qalmaqla 3 gün qalmaq arasında sərbəstdir. (فَمَنْ تَعَجَّلَ فِي يَوْمَيْنِ) - kim tələsib, qurbandan iki gün sonra zülhiccə ayının 12-də dönsə, (فَلَٓا اِثْمَ عَلَيْهِ) - o şəxsə heç bir günah yoxdur. (وَمَنْ تَاَخَّرَ فَلَٓا اِثْمَ عَلَيْهِ) -Kim ki, köç etməyi Minadan təxirə salıb üç gün qurban bayramından sonar köç edərsə zilhiccənin 3-cü günündə o şəxsə heç bir günah yoxdur. (لِمَنِ اتَّقٰى) - bu ixtiyar - zülhiccənin 12, ya da 13-cü günündə qayıtmaq müttəqi şəxslərdən ötrüdür. Ta ki onların qəlblərinə 12, ya da 13-cü gündə qayıtmağın ziddiyyətli fikirləri gəlməsin. (وَاتَّقُوا اللّٰهَ) - Allah-Təaladan qorxub, onun hökmlərinin xilafını etməyin. (وَاعْلَمُوٓا اَنَّكُمْ اِلَيْهِ تُحْشَرُونَ) - bilin ki, həqiqətən,**

وَمِنَ النَّاسِ مَنْ يُعْجِبُكَ قَوْلُهُ فِي الْحَيٰوةِ الدُّنْيَا وَيُشْهِدُ اللّٰهَ عَلٰى مَا فٖي قَلْبِهٖ وَهُوَ اَلَدُّ الْخِصَامِ ﴿٢٠٤﴾
وَاِذَا تَوَلّٰى سَعٰى فِي الْاَرْضِ لِيُفْسِدَ فٖيهَا وَيُهْلِكَ الْحَرْثَ وَالنَّسْلَ وَاللّٰهُ لَا يُحِبُّ الْفَسَادَ ﴿٢٠٥﴾
وَاِذَا قٖيلَ لَهُ اتَّقِ اللّٰهَ

---

**siz hamınız Allah-Təalanın tərəfinə qayıdıb toplanacaqsınız. Allah-Təala onun hökmünə xilaf əməl edən şəxslərdən intiqam alacaqdır.** (Məkkəli Qüreyş camaatından Əxnəs ibn Şüreyq son dərəcə şirin və xoş danışan bir şəxs idi, nə vaxt peyğəmbərlə qarşılaşsa, ona yönəlib gözəl şəkildə danışardı. Hz. Peyğəmbər də onu sevib, imanı səbəbi ilə onu istəyərdi. Allah-Təala peyğəmbərini xəbərdar edir ki, onun imanına ümid yoxdur, heç vaxt onun və onun kimi şəxslərin imanına ümid etməsin, bu barədə bu ayə nazil oldu).

**204) (وَمِنَ النَّاسِ مَنْ يُعْجِبُكَ قَوْلُهُ فِي الْحَيٰوةِ الدُّنْيَا) -** (ey Məhəmməd), **Məkkə əhlindən bir şəxs** (Əxnəs ibn Şüreyq) **və onun sözünün şirinliyi səni sevindirib təəccübləndirir. Onun sözünün şirinliyi bu dünyadadır. Axirətdə onun sözlərinin heç bir şirinliyi və faydası yoxdur. (وَيُشْهِدُ اللّٰهَ عَلٰى مَا فٖي قَلْبِهٖ) -** (Əxnəs ibn Şüreyq and içib deyir:) **Allah-Təala mənim qəlbimə şahiddir ki, səni və islamı sevirəm. (وَهُوَ اَلَدُّ الْخِصَامِ) - halbuki** (Əxnəs ibn Şüreyq) **islama və müsəlmanlara qatı düşmən olub, ədavət edəndir. Müsəlman gərək diqqətli və uzaqgörən olsun, düşmənlə dostuna fərq qoysun. Dostunu düşmən, düşmənini dost hesab etməsin. Həmişə gərək düşməndən ehtiyat etsin.**

**205) (وَاِذَا تَوَلّٰى) –** (ey Məhəmməd, Əxsən ibn Şüreyq səninlə qarşılaşıb xoş danışandan sonra) **dönüb gedəndə, (سَعٰى فِي الْاَرْضِ لِيُفْسِدَ فٖيهَا) - çalışır ki, yer üzündə** (Məkkədə) **bir fəsad törətsin. Ata-ana, qohum-əqrəba ziyarətinə mane olub, müsəlmanların qanının tökülməsinə bais olsun. (وَيُهْلِكَ الْحَرْثَ وَالنَّسْلَ) - çalışır ki, camaatın əkin-biçinini və heyvanlarını həlak edib, yox etsin.** (Həmin Əxnəs ibn Şüreyq gecə vaxtı bir qrup adamı özü ilə götürüb, qəflətən Taif əhlinin üstünə gedib, əkin-biçinlərini yandırıb, heyvanlarını öldürdü. Belə fəsadçı şəxs idi). **(وَاللّٰهُ لَا يُحِبُّ الْفَسَادَ) - halbuki Allah-Təala fəsad etməyi sevməz.** (Ey Məhəmməd, sən belə bir fəsadçı şəxsi necə dost sayırsan? Belə fəsadçılardan üz döndər. Hansı din və məzhəbdə fəsadçı şəxslər olsa, o din və məzhəbdə ixtişaşa və camaatın arasına nifaq salmağa bais olurlar. Fəsadçı şəxslərin əksəriyyəti rəislərdən olur. Ruhani və siyasi rəislər öz hakimiyyətlərindən ötrü o dinin xarab olmasına səy edib, zahirdə özlərini o din və məzhəbin hamisi kimi göstərərlər. Necə ki bizim bu zəmanəmizdə müşahidə olunur. Bu kimi fəsadçıların kökü qoparılmayana qədər o din cəmiyyətdə möhkəm yerləşməz. Diqqət etmək lazımdır).

**206) (وَاِذَا قٖيلَ لَهُ) – o zaman ki Əxnəs ibn Şüreyqə deyildi:** (ey Məhəmməd, sən dedin ona ki,) **(اتَّقِ اللّٰهَ) - Allah-Təaladan qorx, zahir və batinin**

اَخَذَتْهُ الْعِزَّةُ بِالْاِثْمِ فَحَسْبُهُ جَهَنَّمُ ۭ وَلَبِئْسَ الْمِهَادُ ﴿٢٠٦﴾ وَمِنَ النَّاسِ مَنْ يَشْرِي نَفْسَهُ ابْتِغَآءَ
مَرْضَاتِ اللّٰهِ ۭ وَاللّٰهُ رَؤُفٌ بِالْعِبَادِ ﴿٢٠٧﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا ادْخُلُوا فِي السِّلْمِ كَآفَّةً ۖ وَلَا تَتَّبِعُوا
خُطُوَاتِ الشَّيْطَانِ ۭ اِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ ﴿٢٠٨﴾ فَاِنْ زَلَلْتُمْ مِنْ بَعْدِ مَا جَآءَتْكُمُ الْبَيِّنَاتُ فَاعْلَمُوٓا اَنَّ
اللّٰهَ عَزِيزٌ حَكِيمٌ﴿٢٠٩﴾

---

**eyni olsun, zülmü, fəsadı tərk et. (اَخَذَتْهُ الْعِزَّةُ بِالْاِثْمِ) – hakimiyyət qüruru və cahiliyyə qeyrəti onu Allah-Təalaya asi olub günahkar olmağa vadar etdi.** (Qürur insanı günaha salıb həlak edər). **(فَحَسْبُهُ جَهَنَّمُ) – ona məkan kimi cəhənnəm kifayət edər. (وَلَبِئْسَ الْمِهَادُ) - nə pis döşənmiş məkandır cəhənnəm.** (Mühacirlərdən bir nəfər – Süheyb ibn Sinan - Məkkədən Mədinəyə hicrət edəndə, məkkəli Qüreyşdən bir neçə nəfər onun dalınca gəldilər, elə ki ona çatdılar, o, Qüreyşə tərəf dönüb kamana ox qoyub dedi: "Ey camaat, mənim bir neçə oxum var, vallah hər biriylə birinizi qətlə yetirərəm. Ondan sonra siz məni qətlə yetirsəniz də, mənim qətlimdən sizə bir fayda olmaz. Özüm də qoca kişiyəm, gəlin məndən vaz keçin, Məkkədə filan yerdə bir qədər pul gizlətmişəm. Sizin olsun, məndən uzaq olun". Müşriklər razı olub qayıtdılar. Süheyb Mədinədə Hz. Peyğəmbərin hüzuruna gəlib əhvalatı nəql etdi. Peyğəmbər buyurdu: "Böyük mənfəət budur". O vaxt da bu ayə nazil oldu. İslamın ilk dövründə müsəlmanlar belə olublar. Biz müsəlmanlara ar olsun. Adımız var, həqiqətimiz yoxdur. Bir müsəlman ki malını din yolunda xərcləmədi, ona müsəlman demək xətadır. O mal ki, din və məzhəbin tərəqqisi, ümmətin mədəniyyəti, ehtiyacı üçün sərf olunmadı, o mal sahibindən ötrü əzab olub, sahibi də insanlıqdan kənar olar).

**207) (وَمِنَ النَّاسِ مَنْ يَشْرِي نَفْسَهُ ابْتِغَآءَ مَرْضَاتِ اللّٰهِ)** – (ey Məhəmməd)**, insanlardan o şəxs** (Məkkə əhli mühacirlərdən Süheyb ibn Sinan) **ki Allah-Təalanın rizasını tələb etməkdən ötrü dünya malından vaz keçib öz nəfsini dünya malının əvəzində alır, (وَاللّٰهُ رَؤُفٌ بِالْعِبَادِ) - Allah-Təala hicrət edən o bəndələrinə qarşı mehribandır. Onlara nicat verib müşriklərə qalib edəndir.**

**208) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا ادْخُلُوا فِي السِّلْمِ كَآفَّةً) - ey iman gətirən şəxslər, hamınız Allah-Təalanın itaətinə daxil olun, sizdən heç kim islama daxil olandan sonra itaətdən çıxmasın. (وَلَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِ) - şeytanın yoluna (xəbis "nəfsi-əmmarə"nin arzusuna) tabe olmayın, (اِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ) - həqiqətən, şeytan** ("nəfsi-əmmarə") **sizin açıq-aşkar düşməninizdir.**

**209) (فَاِنْ زَلَلْتُمْ) - əgər siz islama daxil olandan sonra ondan çıxsanız, (مِنْ بَعْدِ مَا جَآءَتْكُمُ الْبَيِّنَاتُ) - islamın haqq olması barəsində sizə açıq-aşkar dəlillər gələndən sonra, (فَاعْلَمُوٓا) – belə olan halda bilin ki, * (اَنَّ اللّٰهَ عَزِيزٌ حَكِيمٌ)**

هَلْ يَنْظُرُونَ اِلَّا اَنْ يَاْتِيَهُمُ اللّٰهُ فِي ظُلَلٍ مِنَ الْغَمَامِ وَالْمَلٰٓئِكَةُ وَقُضِيَ الْاَمْرُ وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ
﴿٢١٠﴾ سَلْ بَنِيٓ اِسْرَآءِيلَ كَمْ اٰتَيْنَاهُمْ مِنْ اٰيَةٍ بَيِّنَةٍ وَمَنْ يُبَدِّلْ نِعْمَةَ اللّٰهِ مِنْ بَعْدِ مَا جَآءَتْهُ

---

**həqiqətən, Allah-Təala məxluqata qalib olub hikmət üzrə, haqq ilə onlardan intiqam alandır.**

*(*Qeyd:* *Bir qoca qadın bu ayəni oxuyanda "ğafurun rahim" şəklində oxudu, bir nəfər savadı olmayan ərəb də orada idi, dedi: "Belə olmaz, çünki xəta və günahdan sonra əfv və bağışlanmağı qeyd etmək xalqı günaha vadar etməkdir". Qadın dedi: "Mən xəta etdim, ayə "əzizun həkim"dir". Ərəb dedi: "Hikmətli adamın sözü belə olar". (İlahi kəlamdakı belə incəlikləri ancaq dili yaxşı bilən ərəblər anlaya bilər, avropalı, ingilis və başqa millətlərin - mən Quranı anlayıram deməsi böyük xətadır).*

**210) (هَلْ يَنْظُرُونَ) - islama daxil olandan sonra onu tərk edənlər qiyamət günündə baxıb görməzlər ki, (اِلَّا اَنْ يَاْتِيَهُمُ اللّٰهُ) - Allah-Təalanın əmr** və əzabı onlardan ötrü gəlir? (فِي ظُلَلٍ مِنَ الْغَمَامِ) - bəzi kölgələrin içində ki o kölgələr nazik, lətif buludlardan ibarətdir,** (kölgə və bulud rəhmət yeridir, islama daxil olandan sonra mürtəd olanlar elə ki o kölgə və o buludları görürdülər, qiyamət gününün şiddətli istisindən Allahın rəhməti ilə qorunacaqlarını güman edib, istirahət edərlər. Qəfildən o buludlar onlardan ötrü əzab olar. Belə vaxtda rəhmət güman olunan məkandan əzab vaqe olar. O əzab nə qədər qorxulu və şiddətlidir). **(وَالْمَلٰٓئِكَةُ) - və əzab edən mələklər də hazır olarlar. (وَقُضِيَ الْاَمْرُ) - onların həmişə əzabda olması haqqında Allah-Təalanın hökmü tamam olar. (وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ) – insanların bütün işləri qiyamət günündə Allah-Təala tərəfinə qayıdıb, hər bir şəxs öz əməlinin qarşılığını görəcəkdir.**

*(*** **Qeyd:** *Allah-Təala islamın sabit qalıb dünyaya yayılması üçün bəzən hikmətli tədbirlər və öyüd-nəsihətlər verib, ibadətlər təyin edib ki, o ibadətlərin hamısı islamın tərəqqisi üçündür. Yenə bəzən qissələr bəyan edib ki, hər bir qissə saysız-hesabsız incəlikləri ehtiva edir və bəzən də axirət əzabı ilə qorxudan ayələrini uca peyğəmbərimizin dili ilə bəyan edir. Həqiqətən, islam dini haqqında Qurani-Şərifdən başqa dəlillər istəmək nadanlıq əlamətidir. Nə cahildir! O parlaq günəşi, biyabanda şamla axtarır.).*

**211) (سَلْ بَنِيٓ اِسْرَآءِيلَ)** – (ey Məhəmməd), **bəni-İsraildən soruş: (كَمْ اٰتَيْنَاهُمْ مِنْ اٰيَةٍ بَيِّنَةٍ) - onlara göndərilən peyğəmbərlərin vasitəsiylə o peyğəmbərlər və onların gördükləri dinin haqq olmasına işarə edən açıq-aşkar möcüzələrdən onlara nə qədər bəxş etmişik? Bununla belə, onlar o möcüzələrlə hidayət tapmayıb, onları inkar edib zəlalətə düşdülər. (وَمَنْ يُبَدِّلْ نِعْمَةَ اللّٰهِ) - kim Allah-Təalanın hidayətinə bais olan** (möcüzə) **nemətlərini dəyişdirib, (onları özündən ötrü zəlalət səbəbi etsə, necə ki bəni-İsrail etdi), (مِنْ بَعْدِ مَا جَآءَتْهُ) - o möcüzələr ona gəlib onların möcüzə olduğunu tam biləndən sonra**

فَاِنَّ اللّٰهَ شَد۪يدُ الْعِقَابِ ﴿٢١١﴾ زُيِّنَ لِلَّذ۪ينَ كَفَرُوا الْحَيٰوةُ الدُّنْيَا وَيَسْخَرُونَ مِنَ الَّذ۪ينَ اٰمَنُواۢ وَالَّذ۪ينَ اتَّقَوْا
فَوْقَهُمْ يَوْمَ الْقِيٰمَةِۜ وَاللّٰهُ يَرْزُقُ مَنْ يَشَٓاءُ بِغَيْرِ حِسَابٍ ﴿٢١٢﴾ كَانَ النَّاسُ اُمَّةً وَاحِدَةً فَبَعَثَ اللّٰهُ النَّبِيّ۪نَ
مُبَشِّر۪ينَ وَمُنْذِر۪ينَۖ وَاَنْزَلَ مَعَهُمُ الْكِتَابَ بِالْحَقِّ لِيَحْكُمَ بَيْنَ النَّاسِ ف۪يمَا اخْتَلَفُوا ف۪يهِۜ وَمَا اخْتَلَفَ ف۪يهِ
اِلَّا الَّذ۪ينَ اُو۫تُوهُ مِنْ بَعْدِ مَا جَٓاءَتْهُمُ الْبَيِّنَاتُ بَغْيًا بَيْنَهُمْۚ فَهَدَى اللّٰهُ الَّذ۪ينَ اٰمَنُوا لِمَا اخْتَلَفُوا ف۪يهِ مِنَ الْحَقِّ

---

**yenə möcüzələri inkar edib küfr və zəlalətdə qalsa, (فَاِنَّ اللّٰهَ شَد۪يدُ الْعِقَابِ) - həqiqətən, Allah-Təala o şəxslərə şiddətli əzab edəndir.**

**212) (زُيِّنَ لِلَّذ۪ينَ كَفَرُوا الْحَيٰوةُ الدُّنْيَا) - Allah-Təalanı inkar edən şəxslərdən ötrü dünya həyatı zinətləndirildi. Axirəti birdəfəlik unutdular.** (Şeytandan betər olan nəfsləri onlardan ötrü dünyanı zinətləndirib, axirəti unutdurdu). **(وَيَسْخَرُونَ مِنَ الَّذ۪ينَ اٰمَنُوا) - Quranı inkar edənlər iman gətirənlərin kasıblarına istehza edirdilər,** (ilk vaxtlar Qurana iman gətirənlərin hamısı yoxsul deyildi. Hətta onların arasında var-dövlət, mal sahibi olan Əbu Bəkir, Osman, Əbdürrəhman ibn Əfv kimi şəxslər var idi. Kafirlər deyirdilər: “Siz yoxsulsunuz, biz isə varlıyıq, dünya malına sahibik”. Allah-Təala bir müddət sonra ittifaq və birlik sayəsində həmin yoxsulları o varlılara hakim etdi. Varlı olmaları onlara heç bir fayda vermədi). **(وَالَّذ۪ينَ اتَّقَوْا فَوْقَهُمْ يَوْمَ الْقِيٰمَةِ) - hərçənd kafir olan varlılar dünyada yoxsul olan möminlərdən üstün olublar. Amma qiyamət günündə müttəqi və möminlər kafirlərdən üstün olacaq.** (Axirətdə üstün olmaq faydalıdır, yoxsa dünyada?) **(وَاللّٰهُ يَرْزُقُ مَنْ يَشَٓاءُ بِغَيْرِ حِسَابٍ) - Allah-Təala istədiyinə saysız-hesabsız ruzi verər.**

**213) (كَانَ النَّاسُ اُمَّةً وَاحِدَةً) - Adəmdən sonra müəyyən bir zamana qədər bütün insanlıq bir ümmət, bir millət, hamısı müvəhhid və islam dinində idilər.** (İdris peyğəmbərdən sonra ixtilaf düşüb bütpərəstlik meydana gəldi). **(فَبَعَثَ اللّٰهُ النَّبِيّ۪نَ) - o ixtilafdan sonra Allah-Təala bilinən peyğəmbərlər** (Nuh və ondan sonra gələn peyğəmbərlər) **göndərdi. (مُبَشِّر۪ينَ وَمُنْذِر۪ينَ) - Allah-Təala o peyğəmbərləri rəhməti ilə müjdələyən, əzabı ilə qorxudan göndərdi. (وَاَنْزَلَ مَعَهُمُ الْكِتَابَ بِالْحَقِّ) - Allah-Təala o peyğəmbərləri ilə birlikdə haqq olan kitab da göndərdi. (لِيَحْكُمَ بَيْنَ النَّاسِ ف۪يمَا اخْتَلَفُوا ف۪يهِ) – ta ki o kitab xalqın ixtilaf etdiyi işlərində hökm edib, onları haqq tərəfinə dəlalət etsin.** (Allah-Təala hökm etməkdə kitabını ölçü etdi, peyğəmbərini yox). **(وَمَا اخْتَلَفَ ف۪يهِ اِلَّا الَّذ۪ينَ اُو۫تُوهُ) – onun haqqında ancaq özlərinə kitab verilənlər ixtilaf etdi.** (Halbuki kitab veriləndən sonra gərək əhli-kitab arasında heç bir ixtilaf zahir olmaya idi). **(مِنْ بَعْدِ مَا جَٓاءَتْهُمُ الْبَيِّنَاتُ) - o dinin haqq olması haqqında kitabda aşkar olan dəlillər və sübutlar gələndən sonra onlar yenə ixtilaf etdilər. (بَغْيًا بَيْنَهُمْ) - zülm, fəsad, insafsızlıq onların arasında zahir olduğu üçün bu ixtilaf onlardan meydana gəldi. (فَهَدَى اللّٰهُ الَّذ۪ينَ اٰمَنُوا) - o şəxslər ki Allah-Təalaya iman gətirdilər, Allah-Təala onlara hidayət etdi, (لِمَا اخْتَلَفُوا ف۪يهِ مِنَ الْحَقِّ) - o haqqın**

بِاِذْنِهٖۜ وَاللّٰهُ يَهْدِي مَنْ يَشَٓاءُ اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٢١٣﴾ اَمْ حَسِبْتُمْ اَنْ تَدْخُلُوا الْجَنَّةَ وَلَمَّا يَاْتِكُمْ مَثَلُ الَّذٖينَ خَلَوْا مِنْ قَبْلِكُمْۜ مَسَّتْهُمُ الْبَاْسَٓاءُ وَالضَّرَّٓاءُ وَزُلْزِلُوا حَتّٰى يَقُولَ الرَّسُولُ وَالَّذٖينَ اٰمَنُوا مَعَهُ مَتٰى نَصْرُ اللّٰهِۜ اَلَٓا اِنَّ نَصْرَ اللّٰهِ قَرٖيبٌ ﴿٢١٤﴾

---

**tərəfinə ki, onda ixtilaf etdilər. (بِاِذْنِهٖ) - bu hidayət etmək Allah-Təalanın izni və istəyi ilədir. (وَاللّٰهُ يَهْدِي مَنْ يَشَٓاءُ) - Allah-Təala kimi istəsə, onu hidayət edər, (اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ) - düz yola, ta ki o yolla gedib haqqa qovuşsunlar.** (İxtilaf edilən şey tövhiddən ibarətdir, insana ilk lazım olan şey Allah-Təalanı bir bilmək və ona şərik qoşmamaqdır. İnsan gərək bütün dünya və axirət işlərində Allah-Təaladan yardım istəsin, əgər Allah-Təaladan başqasına yönəlsə, o şəxs müşrikdir).

**214) (اَمْ حَسِبْتُمْ اَنْ تَدْخُلُوا الْجَنَّةَ)** – (ey Qurana iman gətirənlər)**, belə zənn edirsiniz ki, zəhmət və məşəqqət çəkməyib ancaq iman gətirməklə cənnətə daxil olacaqsınız? (Baxın, sizdən əvvəlki ümmətlərin möminləri Allah-Təala yolunda dünyada nə qədər zəhmət və məşəqqət çəkib, o bəlaların, o əməllərinin səbəbinə cənnətə daxil olublar). (وَلَمَّا يَاْتِكُمْ مَثَلُ الَّذٖينَ خَلَوْا مِنْ قَبْلِكُمْ) –sizdən əvvəl gəlib-keçən o peyğəmbərlərin və ümmətlərin əhvalatı sizə gəlib çatmayıbdır? Gərək onların xəbərlərinin sizə gəlməsini gözləyəsiniz. (مَسَّتْهُمُ الْبَاْسَٓاءُ وَالضَّرَّٓاءُ) - onların xəbərləri budur ki, qeyd olunur. Dünyada onlara son dərəcə şiddətli yoxsulluq, naxoşluq və hər bir növ qorxu gəlmişdi, (وَزُلْزِلُوا) – müxtəlif bəlalar onlara gəldiyi üçün həmişə sarsıntı içində oldular.** (Necə ki zəlzələ səbəbi ilə xalq sarsıntı içində olar)**. Onlar üçün heç bir rahatlıq olmadı. Bu hallarına səbir etdilər, (حَتّٰى يَقُولَ الرَّسُولُ وَالَّذٖينَ اٰمَنُوا مَعَهُ) – ta ki axırda peyğəmbər və o şəxslər ki o peyğəmbərlə birlikdə iman gətirmişdilər, Allah-Təalanın yardımını arzu edib dedilər: (مَتٰى نَصْرُ اللّٰهِ) - Allah-Təalanın yardımı və köməyi nə vaxt bizə yetişəcəkdir ki, bunlardan xilas olaq? (اَلَٓا اِنَّ نَصْرَ اللّٰهِ قَرٖيبٌ) - Allah-Təala onlara buyurdu: xəbərdar olun ki, Allah-Təalanın yardımı yaxındır, yetişib sizi bəlalardan xilas edəcək.** (Allah-Təala vədinə vəfa edib onları bəladan xilas etdi. Necə ki Nuh, İbrahim, Musa və başqa peyğəmbərlərin qissələrindən məlumdur. Habelə* siz də ey Qurana iman gətirənlər, din yolunda hər cür bəla və müsibətə gərək səbir edib,

*(*__Qeyd:__ Görəsən, müsəlmanlar niyə bu mübarək ayələrdən heç ibrət almayıb, rahatlığı özlərinə şüar edib, islam yolunda heç bir cəhd etmirlər? Sultandan rəiyyətə qədər gərək hamı din yolunda cidd-cəhdlə çalışıb, bir dəqiqə rahat olmasın. Hər bir şəxs gərək öz vəzifəsini icra etsin. Din və millətə elmdən artıq heç bir şey fayda verməz. Cahil və nadan olan millət və camaat həmişə elm sahiblərinə zidd olublar. Bu mətləbi inkar etmək olmaz. Bu zamanda islam ümməti arasında cəhalət yayğın olduğundan az qalıb ki, müsəlmanlar da yəhudilər kimi özgə millətlərin arasında zəif və*

يَسْـَٔلُونَكَ مَاذَا يُنْفِقُونَ ۖ قُلْ مَآ اَنْفَقْتُمْ مِنْ خَيْرٍ فَلِلْوَالِدَيْنِ وَالْاَقْرَبِينَ وَالْيَتَامٰى وَالْمَسَاكِينِ وَابْنِ
السَّبِيلِ ۗ وَمَا تَفْعَلُوا مِنْ خَيْرٍ فَاِنَّ اللّٰهَ بِهٖ عَلِيمٌ ﴿٢١٥﴾ كُتِبَ عَلَيْكُمُ الْقِتَالُ وَهُوَ كُرْهٌ لَكُمْ ۚ

---

*heysiyyətsiz olsunlar. Şəxsi rəy sahibləri meydana çıxıb, Qurani-Şərif tərk ediləndən bəri müsəlmanlar arasında cəhalət geniş yayılıbdır).*

İslam dininin bayrağını ucaldasınız. Hər bir din, millət ancaq zəhmət çəkib bəla və müsibətlərə səbir etməklə tərəqqi edər, istirahət etməklə din möhkəm olmaz. Hansı millət ki rahatlıq istəyib, özünü din yolunda məşəqqətə vadar etmədi, o millətin tərəqqi etməsinə ümid etmək olmaz). **Sıradakı ayədə hansı şey xərclənib ehsan edilməlidir sualı verilir. Amma Allah-Təala ehsan və xərcləmə yerlərini bəyan etməklə xalqı xəbərdar edir ki, hər bir şeydən ehsan etmək olar, ehsanın xərclənmə yerini soruşmaq lazımdır.**

**215) (يَسْـَٔلُونَكَ)** – (ey Məhəmməd)**, səndən soruşurlar ki, (مَاذَا يُنْفِقُونَ) Allah-Təala yolunda nəyi ehsan edib xərcləmək lazımdır? (قُلْ مَآ اَنْفَقْتُمْ مِنْ خَيْرٍ)** – (ey Məhəmməd)**, onlara de: xərclədiyiniz malda, (فَلِلْوَالِدَيْنِ)- əvvəlcə ata-ana üçün xərcləyin, ondan sonra, (وَالْاَقْرَبِينَ) - sizə soy baxımından yaxın olan qohum-əqrəbalara,* (وَالْيَتَامٰى وَالْمَسَاكِينِ وَابْنِ السَّبِيلِ) - yetimlərə, yoxsullara, müsafirlərə** (öz vilayətlərində mal-mülk sahibi olsalar da, yol əsnasında pulları qurtaran şəxslərə).

*(****Qeyd:*** Allah-Təalanın yetim və yoxsulları valideynlə bərabər tutması ona işarədir ki, valideynə ehsan etmək vacib olduğu kimi, yetim və yoxsula da ehsan etmək, onun xərclərinə kəfil olmaq vacibdir, onlara, xüsusilə yetim uşaqlara tərbiyə vermək ilahi əmanətdir. Onlara təlim-tərbiyə vermək, onları böyük mərtəbələrə çatdırmaq, onlardan ötrü məktəb və mədrəsələr tikmək lazımdır. Görəsən, mütləq qüdrət sahibi olan Allah heç razı olar ki, varlı şəxs ömrünü istirahətlə keçirsin, amma yoxsul müsəlmanlar, onların uşaqları məhv və tələf olsunlar? Keçmiş əzəmətli sultanların tarixi əhvalatlarına bax gör ki, insanlığa və islama nə qədər xidmət ediblər. Onlardan bir də Müzəffərəddin Gökburdur. Gökbur türk adıdır. Yəni göy qurd,* ***(canavar)****. Ərbildə hicri 600-cü ildə sultan olubdur, əgər bu uca sultanın əhvalatına agah olsan, hər halda təəccüb edərsən ki, bu bir nəfər şəxs az bir zamanda nə qədər xeyir əməllər edibdir. Nə qədər məktəb, mədrəsə, kitabxana, karvansaray, yoxsullar və yetimlər üçün sığınacaq yerləri, istirahət evləri tikib, hamısından ötrü kifayət qədər avadanlıq və pul ayırmışdı. Əgər bu uca şəxsin əhvalat və hərəkətlərinə agah olmaq istəsən, "Tarixi-ibn Xallikan"a bax, orada səndən ötrü mətləb aydın olar, o vaxt bilərsən ki, islamda necə kişilər və şəxslər olubdur. Allah hamısına rəhmət etsin!)*

**(وَمَا تَفْعَلُوا مِنْ خَيْرٍ) – nə ki xeyir əməl edirsiniz, (فَاِنَّ اللّٰهَ بِهٖ عَلِيمٌ) - Allah-Təala o əməllərinizə agahdır, onun mükafatını sizə verəcəkdir.**

**216) (كُتِبَ عَلَيْكُمُ الْقِتَالُ) - müşriklərlə cihad etmək sizlərə yazılıb vacib oldu. (وَهُوَ كُرْهٌ لَكُمْ) - cihad etmək sizə ağır və məşəqqətli gəlib, xoşlanma-**

وَعَسٰۤى اَنْ تَكْرَهُوا شَيْـًٔا وَهُوَ خَيْرٌ لَكُمْۚ وَعَسٰۤى اَنْ تُحِبُّوا شَيْـًٔا وَهُوَ شَرٌّ لَكُمْۜ وَاللّٰهُ يَعْلَمُ وَاَنْتُمْ لَا تَعْلَمُونَ۟ ﴿٢١٦﴾ يَسْـَٔلُونَكَ عَنِ الشَّهْرِ الْحَرَامِ قِتَالٍ فِيهِۜ قُلْ قِتَالٌ فِيهِ كَبِيرٌۜ وَصَدٌّ عَنْ سَبِيلِ اللّٰهِ وَكُفْرٌ بِهٖ وَالْمَسْجِدِ الْحَرَامِ وَاِخْرَاجُ اَهْلِهٖ مِنْهُ اَكْبَرُ عِنْدَ اللّٰهِۚ وَالْفِتْنَةُ اَكْبَرُ مِنَ الْقَتْلِۜ وَلَا يَزَالُونَ يُقَاتِلُونَكُمْ حَتّٰى يَرُدُّوكُمْ عَنْ دٖينِكُمْ اِنِ اسْتَطَاعُواۜ وَمَنْ يَرْتَدِدْ مِنْكُمْ عَنْ دٖينِهٖ فَيَمُتْ وَهُوَ كَافِرٌ فَاُو۬لٰٓئِكَ حَبِطَتْ اَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْاٰخِرَةِۚ وَاُو۬لٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فٖيهَا خَالِدُونَ ﴿٢١٧﴾

---

**sanız da. (وَعَسٰۤى اَنْ تَكْرَهُوا شَيْـًٔا) - ümid edilir ki, məşəqqətli bilib istəmədiyiniz şey, (وَهُوَ خَيْرٌ لَكُمْ) - o şey bəlkə də sizdən ötrü xeyir olsun,** (cihad əmrini xoşlamırsınız, amma agah deyilsiniz ki, onun nə qədər mənfəəti var. Siz şəxsi mənfəətinizi gözləyirsiniz, amma cihadda ümumi mənfəət vardır. Ağıllı şəxs şəxsi mənfəəti ümumi mənfəətdən üstün saymaz)**. (وَعَسٰۤى اَنْ تُحِبُّوا شَيْـًٔا) – ümid edilir ki, istədiyiniz şey, (وَهُوَ شَرٌّ لَكُمْ) - o şey, bəlkə də, sizdən ötrü şər olsun,** (cihadı tərk etmək istəyirsiniz, amma cihadı tərk etsəniz, düşmən sizə qalib gələr, düşmənə tabe olarsınız. Düşmən əlində zəlil olmaqdan daha böyük şər varmı?) **(وَاللّٰهُ يَعْلَمُ) - sizdən ötrü xeyir və şərrin nə olduğunu Allah-Təala bilir. (وَاَنْتُمْ لَا تَعْلَمُونَ) - halbuki siz buna agah deyilsiniz, buna görə də Allah-Təalanın buyurduğu hökmə gərək itaət edəsiniz.**

**217) (يَسْـَٔلُونَكَ عَنِ الشَّهْرِ الْحَرَامِ قِتَالٍ فِيهِ)** – (ey Məhəmməd)**, səndən haram aylar və onda cihad etmək haqqında soruşurlar,** (haram aylar həmin 4 aydır ki, o aylarda savaşmaq haramdır: zülqədə, zülhiccə, məhərrəm, rəcəb)**, (قُلْ قِتَالٌ فِيهِ كَبِيرٌ) -** (ey Məhəmməd)**, de ki, o haram aylarda savaşmaq böyük günahdır. (وَصَدٌّ عَنْ سَبِيلِ اللّٰهِ) - qeyd olunan aylarda savaşmaq xalqın həccə gedib-gəlməsinə mane olmaqdır. (وَكُفْرٌ بِهٖ) - xalqın həcc etməsinə mane olmaq Allah-Təalanı inkar etməkdir. (وَالْمَسْجِدِ الْحَرَامِ وَاِخْرَاجُ اَهْلِهٖ مِنْهُ اَكْبَرُ عِنْدَ اللّٰهِ) - amma Məscidül-hərama daxil olmağa mane olmaq və Məscidül-həramın əhlini oradan çıxartmaq Allah-Təala yanında fəsad və haram işlərdə haram aylarda savaşmaqdan daha böyük günahdır.** (Yəni ey Məhəmməd, Qüreyş əhlinin səni və möminləri Məkkədən çıxartması haram aylarda savaşmaqdan daha artıq günahdır)**. (وَالْفِتْنَةُ اَكْبَرُ مِنَ الْقَتْلِ)** – (ey Məhəmməd)**, fitnə salıb sizi Məkkədən çıxartmaq** (Necə ki elə də etdilər) **və Məkkə əhlinin şirk içində qalması fəsad və haramlıqda haram aylarda savaşıb insanları qətl etməkdən daha böyük günahdır. (وَلَا يَزَالُونَ يُقَاتِلُونَكُمْ)** – (ey Məhəmməd)**, Məkkə müşrikləri sizinlə həmişə savaşırlar, (حَتّٰى يَرُدُّوكُمْ عَنْ دٖينِكُمْ اِنِ اسْتَطَاعُوا) – əgər qadir olsalar, sizi dininizdən döndərsinlər. (وَمَنْ يَرْتَدِدْ مِنْكُمْ عَنْ دٖينِهٖ فَيَمُتْ وَهُوَ كَافِرٌ) - sizdən kim ki öz dinindən dönüb, ondan sonra kafir olduğu halda ölsə, (فَاُو۬لٰٓئِكَ حَبِطَتْ اَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ) - o mürtəd olanların əməlləri dünya və axirətdə batil olar. (وَاُو۬لٰٓئِكَ اَصْحَابُ النَّارِ) - onlar cəhənnəm yoldaşlarıdır, (هُمْ فٖيهَا خَالِدُونَ) - əlbəttə, onlar cəhənnəmdə həmişəlik qalanlardır.**

اِنَّ الَّذِينَ اٰمَنُوا وَالَّذِينَ هَاجَرُوا وَجَاهَدُوا فِي سَبِيلِ اللّٰهِ اُولٰٓئِكَ يَرْجُونَ رَحْمَتَ اللّٰهِ وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ
﴿٢١٨﴾ يَسْـَٔلُونَكَ عَنِ الْخَمْرِ وَالْمَيْسِرِ قُلْ فِيهِمَٓا اِثْمٌ كَبِيرٌ وَمَنَافِعُ لِلنَّاسِ

---

**218) (اِنَّ الَّذِينَ اٰمَنُوا) -** (bu ayə hicrət edib Allah-Təala yolunda islamın möhkəmlənməsində canı, malı və dili ilə cihad edənlərin haqqında nazil olubdur). **Həqiqətən, o şəxslər ki Allah-Təalaya iman gətiriblər, (وَالَّذِينَ هَاجَرُوا وَجَاهَدُوا فِي سَبِيلِ اللّٰهِ) - və o şəxslər ki hicrət edib Allah-Təala yolunda cihad etdilər, (اُولٰٓئِكَ يَرْجُونَ رَحْمَتَ اللّٰهِ) - onlar Allah-Təalanın rəhmətini ümid edərlər.** (Yəni belə xeyir əməl sahibləri hicrət edib cihad etməklə Allah-Təalanın rəhmətini ümid edərlər. Amma o şəxslər ki heç bir xeyir əməl sahibi deyil, onların Allah-Təalanın rəhmətinə ümidvar olmaları xətadır). **(وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ) - Allah-Təala bağışlayan və rəhm edəndir o şəxslərə ki, rəhmətə layiq olsunlar.** (Şərabın və sərxoş edən bütün içkilərin haram olması haqqında 4 ayə nazil olubdur. Allah-Təala onların haram olmasını tədricən bəyan edibdir. İlk ayə Nəhl surəsində Məkkədə nazil olub: “Xurma bağçalarının və üzüm bağlarının meyvələrindən həm sərxoşluq verən bir şey çıxarırsınız, həm də gözəl bir ruzi” (Nəhl, 67). İkinci gələn ayə Bəqərə surəsində Mədinədə nazil olub: “(Ey Məhəmməd!) Sənə şərab və qumar haqqında sual verirlər. De ki, hər ikisində də böyük günah vardır. Bununla belə onlarda insanlar üçün bəzi dünyəvi faydalar da var. Amma onların günahları Allah yanında mənfəətlərindən daha böyükdür” (Bəqərə, 219). Üçüncü ayə Nisa surəsində Mədinədə nazil olub: “Ey iman edənlər! Sərxoş ikən – nə dediyinizi anlayana qədər namaza yaxınlaşmayın” (Nisa, 43). Dördüncü ayə Maidə surəsində Mədinədə nazil olub: “Ey iman edənlər! İçki, qumar, bütlər və fal oxları şeytanın işi olub murdar şeylərdir. O halda onlardan çəkinin ki, nicat tapasınız. İçki və qumarla şeytan aranıza düşmənçilik, kin salmaq, sizin Allahı zikr etməyiniz, namaz qılmağınıza mane olmaq istəyər. Artıq vaz keçirsiniz, elə deyilmi?” (Maidə, 90-91). Bu axırıncı ayə bunların açıq-aşkar haram olduğunu bildirir. Aşağıdakı ayə də Mədinədə nazil olub. İnşallah, tədricən hər biri öz məqamında qeyd olunacaq. Hz. Peyğəmbərin səhabələrindən Ömər əl-Faruq və Muaz ibn Cəbəl ərz etdilər: “Ey peyğəmbər, hökm et ki, şərab və qumar haram olsun. Çünki şərab ağlı, qumar da malı yox edir”. O zaman da bu ayə nazil oldu).

**219-220) (يَسْـَٔلُونَكَ)** – (ey Məhəmməd)**, səndən soruşurlar, (عَنِ الْخَمْرِ وَالْمَيْسِرِ) -şərab* və qumarın haram olması haqda,**

*(*****Qeyd:** Hz. Əli (ə.s) buyurdu: “Əgər şərabdan bir qətrə quyuya düşsə və onun yerində bir minarə tikilsə, mən o minarədə azan vermərəm. Əgər bir qətrə dənizə düşsə, ondan sonra o dəniz quruyub onda ot bitsə, mən onda heyvanlarımı otarmaram”).*

**(قُلْ فِيهِمَٓا اِثْمٌ كَبِيرٌ) - de ki, şərab və qumarda böyük günah vardır. (وَمَنَافِعُ لِلنَّاسِ) - günahla birlikdə onlarda xalq üçün dünya mənfəəti də vardır.**

وَاِثْمُهُمَآ اَكْبَرُ مِنْ نَفْعِهِمَاؕ وَيَسْـَٔلُونَكَ مَاذَا يُنْفِقُونَ ۜ قُلِ الْعَفْوَ ۜ كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ لَعَلَّكُمْ
تَتَفَكَّرُونَ ۙ ﴿٢١٩﴾ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ وَيَسْـَٔلُونَكَ عَنِ الْيَتَامٰى قُلْ اِصْلَاحٌ لَهُمْ خَيْرٌ ۜ

---

(Şərabda ləzzət almaq və cuşa gəlib xoş söhbət etmək vardır. Amma qumar kimə qalib gəlsə, onun əlindən malını alıb, başqalarını şad edib, iftixar etdirər. Şərab və qumarın faydası bunlardır. Bunlar da fəna olan şeylərdir). **(وَاِثْمُهُمَآ اَكْبَرُ مِنْ نَفْعِهِمَا) - amma onların günahları Allah-Təala yanında onların mənfəətlərindən daha böyükdür. Ağıllı şəxs dünyanın az olan mənfəətini axirətin şiddətli olan əzabına üstün sayarmı?** (Elə ki bu ayə nazil oldu, müsəlmanlardan bir qrup şərab və qumarı tərk edib, digər bir qrup ayənin haram buyurması aydın olmadığına görə Maidə surəsindəki ayə nazil olana qədər keçmiş əməllərinə davam etdilər). (və yəsəlunəkə maza yunfiqun) **(وَيَسْـَٔلُونَكَ مَاذَا يُنْفِقُونَ )** – (ey Məhəmməd)**, səndən soruşurlar ki, Allah-Təala yolunda nəyi xərcləyib ehsan etsinlər? (قُلِ الْعَفْوَ ) – de ki, nəyi ehsan edirsiniz, edin, amma xərcləməkdə* orta yolu seçin, bütün malınızı verməyin. Ta ki özünüz möhtac olmayasınız və ehsan etməyi birdəfəlik dayandırmayın. Ta ki xəsis olmayasınız.**

*(*__Qeyd:__ Bir kişi peyğəmbərin hüzuruna gəlib savaşda qənimət aldığı qızıl bir dəbilqəni gətirdi. Ərz etdi: “Ey peyğəmbər, bu, sədəqədir”. Hz. Peyğəmbər ona baxmayıb üzünü çevirdi. O kişi yenidən gəlib ərz etdi: “Ey peyğəmbər, bu sədəqəni məndən qəbul edib yoxsul müsəlmanlara bağışla”. Peyğəmbər qəzəblənib dedi: “Ver”. O şəxs dəbilqəni peyğəmbərə verdi. Hz. Peyğəmbər dəbilqəni əlinə alıb qüvvətlə o şəxsə tərəf elə atdı ki, əgər o şəxsə dəysəydi, hər halda başını sındırardı. Buyurdu: “Nə olubdur sizə? Sizdən biriniz bütün malını gətirib sədəqə verir, ondan sonra da özü möhtac qalıb, gərək dilənçilik etsin? Sədəqə vermək var-dövlət sahibi şəxsə lazımdır”. Bu hədisə və sair hədislərə baxanda o həzrətin ümmətinin varlı olmasını yoxsul olmasından üstün sayması aydın olur. Xalqın nəzərində dünya malını qəbih göstərənlərin məqsədi onların əlində olan malı ələ keçirməkdir. Dünyanı pisləyən hədislərdən məqsəd dünyada varlı olmağı qadağan etmək deyil, əksinə, insanı Allah-Təaladan uzaqlaşdırıb, başqa şeylərə yönləndirən şeylər pislənir. O şey ola bilər ki, dünya malı olsun, ola bilər ki, zahiri ibadət və itaət olsun. Necə ki özünü alim sayan riyakar şəxslərin əməli bəsirət əhlinin yanında zahir və aşkardır).*

**(كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ) - habelə Allah-Təala öz ayələrini sizdən ötrü bəyan edir ki, ( لَعَلَّكُمْ تَتَفَكَّرُونَ . فِي الدُّنْيَا وَالْاٰخِرَةِ) – bəlkə dünya və axirət işlərində məsləhətli olan şeyləri təfəkkür edib seçəsiniz,** (müsəlmanlar yetimlərin işləri ilə məşğul olmaqdan çəkinirdilər ki, birdən yetimlərin mallarını idarə etmək onlardan ötrü günah olar. Hz. Peyğəmbərdən bunu soruşdular, Allah-Təala da o zaman bu hökmü nazil etdi). (وَيَسْـَٔلُونَكَ عَنِ الْيَتَامٰى) – (ey Məhəmməd), **yetimlərin işləri ilə məşğul olmağı səndən soruşurlar. (قُلْ اِصْلَاحٌ لَهُمْ خَيْرٌ) – onlara de ki, yetimlərin işlərini islah etmək üçün onların mallarını mühafizə**

وَاِنْ تُخَالِطُوهُمْ فَاِخْوَانُكُمْۜ وَاللّٰهُ يَعْلَمُ الْمُفْسِدَ مِنَ الْمُصْلِحِۜ وَلَوْ شَآءَ اللّٰهُ لَاَعْنَتَكُمْۜ اِنَّ اللّٰهَ عَزِيزٌ حَكِيمٌ
﴿٢٢٠﴾ وَلَا تَنْكِحُوا الْمُشْرِكَاتِ حَتّٰى يُؤْمِنَّۜ وَلَاَمَةٌ مُؤْمِنَةٌ خَيْرٌ مِنْ مُشْرِكَةٍ وَلَوْ اَعْجَبَتْكُمْۚ وَلَا
تُنْكِحُوا الْمُشْرِكِينَ حَتّٰى يُؤْمِنُواۜ وَلَعَبْدٌ مُؤْمِنٌ خَيْرٌ مِنْ مُشْرِكٍ وَلَوْ اَعْجَبَكُمْۜ اُولٰٓئِكَ يَدْعُونَ اِلَى النَّارِۚ

---

**etmək yaxşı əməldir. (وَاِنْ تُخَالِطُوهُمْ) - əgər siz o yetimlərə qarışıb onların işləri ilə məşğul olsanız, (فَاِخْوَانُكُمْ) - o yetimlər islam dininə görə sizin qardaşlarınızdır. Qardaşın işi ilə məşğul olub ona kömək olmaq qardaşlıq haqqını yerinə yetirməkdir. Onların işini islah etməkdən ötrü yetimlərin işləri ilə məşğul olun. (وَاللّٰهُ يَعْلَمُ الْمُفْسِدَ مِنَ الْمُصْلِحِ) - Allah-Təala yetimlərin işləri ilə fəsad salmaqdan ötrü məşğul olan şəxsi islah etməkdən ötrü məşğul olan şəxsdən fərqləndirib hər ikisinin əhvalına agahdır. (وَلَوْ شَآءَ اللّٰهُ لَاَعْنَتَكُمْ) - əgər Allah-Təala istəsə, hər halda sizi məşəqqətə salıb yetimlərin işləri ilə məşğul olmanıza razı olmaz. (اِنَّ اللّٰهَ عَزِيزٌ حَكِيمٌ) - həqiqətən, Allah-Təala məxluqata qalib olub onları məşəqqətə salmağa qadirdir. Amma hikmət sahibidir, xalqın taqətindən artıq olan işi onlara təklif etməz.** (Hz. Peyğəmbər Məkkədən Mədinəyə hicrət edəndən sonra müsəlmanlardan bəziləri Məkkədə qaldı, müşriklər onlara əziyyət etsə də, onların Məkkədən çıxması mümkün deyildi. Məkkənin fəthindən əvvəl Hz. Peyğəmbər öz səhabələrindən cəsarətli və şücaətli olan Mərsəd ibn Əbu Mərsəd Ğənəvini o şəxsləri Məkkədən Mədinəyə gətirməkdən ötrü Məkkəyə göndərdi. Mərsəd elə ki Məkkəyə varid oldu, cahiliyyə zamanından tanıdığı fahişə müşrik bir qadın olan Ənaqla qarşılaşdı. Ənaq dedi: “ey Mərsəd, istəyirsənsə, bir gününü mənimlə keçir”. Mərsəd dedi: “İslam səninlə mənim aramda bir pərdə oldu”. Ənaq dedi: “Mənimlə evlən”. Mərsəd dedi: “Evlənərəm, amma gərək peyğəmbərdən izin alam”. Mədinəyə gəlib bu macəranı Hz. Peyğəmbərə ərz etdi, o zaman gələn ayə müşriklərlə nikahlanmaq və müşriklərə qız vermək barəsində nazil oldu (Tirmizi, Təfsir, Nur (3176); Əbu Davud, Nikah 5; Nəsai, Nikah 12)).

**221) (وَلَا تَنْكِحُوا الْمُشْرِكَاتِ حَتّٰى يُؤْمِنَّ)** – (Hz. Məhəmmədə və Qurana) **iman gətirincəyə qədər müşrik qadınlarla nikahlanmayın,** (bu hökm müşrik və bütpərəstlərə məxsusdur. Amma əhli-kitab bu hökmün xaricindədirlər, onlardan qız almaq caizdir. Necə ki bundan sonra gələn Maidə surəsində bəyan olunacaqdır). **(وَلَاَمَةٌ مُؤْمِنَةٌ خَيْرٌ مِنْ مُشْرِكَةٍ وَلَوْ اَعْجَبَتْكُمْ) - əlbəttə, mömin bir kənizlə evlənmək gözəlliyi sizi heyrətləndirsə də, bir müşriklə evlənməkdən yaxşıdır. (وَلَا تُنْكِحُوا الْمُشْرِكِينَ حَتّٰى يُؤْمِنُوا) - ey möminlər, mömin qadınları müşriklər iman edənə qədər onlarla nikahlamayın, (وَلَعَبْدٌ مُؤْمِنٌ خَيْرٌ مِنْ مُشْرِكٍ وَلَوْ اَعْجَبَكُمْ) - əlbəttə, bir qulam, mömin camalı sizi heyrətləndirsə də, müşrik bir şəxsdən yaxşıdır, (اُولٰٓئِكَ يَدْعُونَ اِلَى النَّارِ)- o müşrik qadınlar və kişilər cəhənnəm oduna bais olan küfrə dəvət edirlər.** (Ola bilər ki, mömin qadın müşrik ərinə, ya mömin kişi müşrik arvadına tabe olub, islamdan dönüb

وَاللّٰهُ يَدْعُوٓا اِلَى الْجَنَّةِ وَالْمَغْفِرَةِ بِاِذْنِه۪ۚ وَيُبَيِّنُ اٰيَاتِه۪ لِلنَّاسِ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ ۟﴿٢٢١﴾ وَيَسْـَٔلُونَكَ عَنِ الْمَح۪يضِۜ قُلْ هُوَ اَذًىۙ فَاعْتَزِلُوا النِّسَٓاءَ فِي الْمَح۪يضِۙ وَلَا تَقْرَبُوهُنَّ حَتّٰى يَطْهُرْنَۚ فَاِذَا تَطَهَّرْنَ فَأْتُوهُنَّ مِنْ حَيْثُ اَمَرَكُمُ اللّٰهُۜ اِنَّ اللّٰهَ يُحِبُّ التَّوَّاب۪ينَ وَيُحِبُّ الْمُتَطَهِّر۪ينَ ﴿٢٢٢﴾ نِسَٓاؤُ۬كُمْ حَرْثٌ لَكُمْۖ فَأْتُوا حَرْثَكُمْ اَنّٰى شِئْتُمْۘ

---

küfrə daxil olsun. Bu səbəbdən möminlər ilə müşriklər arasında gərək nikah kəsilməsin). (وَاللّٰهُ يَدْعُوٓا اِلَى الْجَنَّةِ وَالْمَغْفِرَةِ بِاِذْنِه۪) **- Allah-Təala öz izni və yardımı ilə sizi cənnətə və bağışlanmağa dəvət edir, ağıllı şəxs cənnəti tərk edib cəhənnəmə gedərmi?** (وَيُبَيِّنُ اٰيَاتِه۪ لِلنَّاسِ) **-Allah-Təala öz ayələrini xalqdan ötrü bəyan edir ki,** (لَعَلَّهُمْ يَتَذَكَّرُونَ) **– bəlkə agah olub Allah-Təalanın dəvətini qəbul edib cənnətə yönəlsinlər.** (Yəhudi camaatı qadınları aybaşı olan zaman onlarla birlikdə yeməkdən, içməkdən və bir mənzildə olmaqdan və cinsi əlaqədən çəkinərdilər. Möminlər bunun haqqında haqda peyğəmbərə sual verdilər. O zaman bu ayə nazil oldu ki, aybaşı vaxtı qadınlarla cinsi əlaqədən çəkinmək lazımdır, amma o şeylərdən ki yəhudi camaatı çəkinir, onlardan çəkinmək lazım deyil (Müslüm, Heyz, 302)).

**222)** (وَيَسْـَٔلُونَكَ عَنِ الْمَح۪يضِ) – (ey Məhəmməd)**, aybaşı halındakı qadınlarla cinsi əlaqə haqqında səndən soruşurlar.** (قُلْ هُوَ اَذًى) **- onlara de ki, aybaşı pis və kirli olan bir şeydir. Ondan çəkinmək lazımdır.** (فَاعْتَزِلُوا النِّسَٓاءَ فِي الْمَح۪يضِ) **- aybaşı halındakı qadınlardan uzaq olub onlarla cinsi əlaqədə olmayın.** (وَلَا تَقْرَبُوهُنَّ حَتّٰى يَطْهُرْنَ) **– aybaşından təmizlənincəyə qədər cinsi əlaqədən ötrü qadınlara yaxınlaşmayın,** (amma başqa şeylərdən çəkinmək lazım deyil). (فَاِذَا تَطَهَّرْنَ) **– nə zaman ki pak olub qüsl etdilər,** (فَأْتُوهُنَّ مِنْ حَيْثُ اَمَرَكُمُ اللّٰهُ) **– cinsi əlaqədən ötrü qadınlara o yerdən** (yəni arxadan yox, öndən) yaxınlaşın ki, Allah-Təala onu əmr edib və halal buyurubdur. Bu ayə buna dəlildir ki, qadınla arxadan cinsi əlaqəyə girmək haramdır. Çünki qadına arxadan yaxınlaşmaq spermanı zay edir, cinsi əlaqədə əsl məqsəd isə nəsli davam etdirməkdir. Diqqət et, bu, haram olduğu halda, gör kişilərlə əlaqəyə girmək və homoseksuallıq nə dərəcədə haramdır). (اِنَّ اللّٰهَ يُحِبُّ التَّوَّاب۪ينَ وَيُحِبُّ الْمُتَطَهِّر۪ينَ) **- həqiqətən, səhvən qadını ilə arxadan əlaqəyə girib, ondan sonra tövbə edən şəxsləri və xəbis olan əməllərdən çəkinib pak olanları Allah-Təala sevər.** (İslam alimlərinin ittifaqı ilə müsəlmanların aybaşı olan qadınla cinsi əlaqədə olması haramdır).

**223)** (نِسَٓاؤُ۬كُمْ حَرْثٌ لَكُمْ) **sizin qadınlarınız sizdən ötrü əkin yeridir. Necə ki, əkində toxum lazımdır ki, ondan meyvə hasil olsun, habelə sizdən də toxum lazımdır ki, övlad əmələ gəlsin.** (فَأْتُوا حَرْثَكُمْ اَنّٰى شِئْتُمْ) **cinsi əlaqədən ötrü əkin yeri olan qadınlarınıza istədiyiniz kimi** (arxadan yox, ancaq öndən) **və istədiyiniz məkanda yaxınlaşın.** (Çünki qadının arxası əkin yeri deyil. Ora-

وَقَدِّمُوا لِاَنْفُسِكُمْ ۜ وَاتَّقُوا اللّٰهَ وَاعْلَمُوٓا اَنَّكُمْ مُلَاقُوهُ ۜ وَبَشِّرِ الْمُؤْمِنِينَ ﴿٢٢٣﴾ وَلَا تَجْعَلُوا اللّٰهَ
عُرْضَةً لِاَيْمَانِكُمْ اَنْ تَبَرُّوا وَتَتَّقُوا وَتُصْلِحُوا بَيْنَ النَّاسِ وَاللّٰهُ سَمِيعٌ عَلِيمٌ ﴿٢٢٤﴾ لَا يُؤَاخِذُكُمُ اللّٰهُ
بِاللَّغْوِ فِيٓ اَيْمَانِكُمْ وَلٰكِنْ يُؤَاخِذُكُمْ بِمَا كَسَبَتْ قُلُوبُكُمْ وَاللّٰهُ غَفُورٌ حَلِيمٌ ﴿٢٢٥﴾

---

da sperma zay olar. Hərçənd ayədə arxadan yaxınlaşmağın haramlığı aşkar bəyan edilibdir. Amma qadınların sizdən ötrü əkin yeri olması demək arxadan yaxınlaşmağın haramlığına böyük dəlildir). (وَقَدِّمُواْ لأَنفُسِكُمْ) – (ölməkdən qabaq) **özünüzdən ötrü saleh əməl göndərin.** (Allah-Təalanın qadağan etdiyi şeyləri etməyin. Qadınlarla arxadan cinsi əlaqədə olmayın). (وَاتَّقُواْ اللّهَ) - **Allah-Təaladan qorxub qadağan etdiyi şeylərə cəsarət eləməyin.** (وَاعْلَمُواْ أَنَّكُم مُّلاَقُوهُ) - **bilin və agah olun ki, qiyamət günündə Allah-Təalanın hüzuruna gedib əməllərinizin cəzasını görəcəksiniz.** (وَبَشِّرِ الْمُؤْمِنِينَ) – (ya Məhəmməd), **möminləri müjdələ ki, yaxşı əməlləri səbəbilə Allah-Təalanın yanında əziz və möhtərəm olacaqlar.** (Hz. Peyğəmbərin səhabələrindən Abdullah ibn Rəvaha ilə Bişr ibn Numan arasında kin-küdurət yaranmışdı. Abdullah and içdi ki, Bişr ibn Numan ilə danışmayıb, onun mənzilinə daxil olmayıb, ona yaxşılıq eləməyib, onunla qohumunun arasını islah etməsin. O vaxt da bu ayə nazil oldu).

**224)** (وَلاَ تَجْعَلُواْ اللّهَ عُرْضَةً لِّأَيْمَانِكُمْ) - **and içdiyiniz şeylərdən ötrü Allah-Təalanı maneə etməyin,** (yəni deməyin: and içmişəm ki, filan yaxşı əməli bir də etməyim, çünki yaxşı olan şeylərin tərkinə and içmək yanlışdır.) (أَن تَبَرُّواْ وَتَتَّقُواْ وَتُصْلِحُواْ بَيْنَ النَّاسِ) - **and içirsiniz ki, ehsan eləməyib, təqvaya səbəb olan qohum-əqrəba ziyarətini tərk eləyib, insanların arasını islah etməyəsiniz.** (Belə and* içməyi tərk eləyin. Çünki bunlar tamamən islamın qanunlarına zidd və xalqın təqvanı tərk etməsinə səbəbdir. Gərək siz təfriqəyə bais olan şeyləri tərk eləyib, ittifaq və birliyə bais olan şeyləri edəsiniz). (وَاللّهُ سَمِيعٌ عَلِيمٌ) - **Allah-Təala sizin bu and içməyinizi eşidib, niyyətlərinizə agahdır.**

*(*Qeyd: Hərçənd bu ayə və bundan başqa sair ayələr xüsusi məsələlər haqqında nazil olubdur. Amma hökmləri bütün müsəlmanlara şamildir. Bunun dəlili odur ki, müəyyən şəxs barəsində nazil olunan ayədə o şəxsin adı qeyd olunmayıb, ayədə bütün müsəlmanlara xitab olunur).*

**225)** (لاَّ يُؤَاخِذُكُمُ اللّهُ) - **Allah-Təala sizi cəzalandırmaz,** (بِاللَّغْوِ فِيَ أَيْمَانِكُمْ) - **boş və mənasız and içməyinizdən ötrü vallah, billah dediyiniz üçün.** (Qəlbiniz qafil olub niyyətiniz and içmək olmasa, Allah-Təala bundan ötrü sizə əzab eləməz). (وَلَكِن يُؤَاخِذُكُم) – **amma Allah-Təala sizi cəzalandırar,** (بِمَا كَسَبَتْ قُلُوبُكُمْ)- **o and içməkdən ötrü ki, qəlbiniz ona niyyət eləyibdir.** (وَاللّهُ غَفُورٌ حَلِيمٌ) - **Allah-Təala niyyətsiz and içməyi bağışlayıb, günahkarlara əzab etməkdə tələsən deyildir.** (Gələn ayə o hökmün barəsində nazil olubdur ki, o

لِلَّذِينَ يُؤْلُونَ مِنْ نِسَآئِهِمْ تَرَبُّصُ اَرْبَعَةِ اَشْهُرٍۚ فَاِنْ فَآؤُ فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ ﴿٢٢٦﴾ وَاِنْ عَزَمُوا الطَّلَاقَ فَاِنَّ اللّٰهَ سَمِيعٌ عَلِيمٌ ﴿٢٢٧﴾ وَالْمُطَلَّقَاتُ يَتَرَبَّصْنَ بِاَنْفُسِهِنَّ ثَلٰثَةَ قُرُوٓءٍ وَلَا يَحِلُّ لَهُنَّ اَنْ يَكْتُمْنَ مَا خَلَقَ اللّٰهُ فِيٓ اَرْحَامِهِنَّ

---

hökmə “ila” deyilir. “İla” odur ki, kişi öz qadınına and içir ki, vallah mən sənə 4 ay, ya da daha artıq, 5 ay, ya da 6 ay yaxınlaşmaram. (Tusi, Təhzib, VIII/2; İstibsar, III/252) Çünki kişiyə 4 gecədə bir dəfə öz qadınının yanında yatmaq və 4 ayda bir dəfə əlaqədə olmaq vacibdir. Əgər tərk eləsə qadının haqqıdır ki, gərək kişi ondan halallıq alsın. Amma bu 4 aydan başqa qadının cinsi əlaqə mövzusunda heç bir haqqı yoxdur. O səbəbdən “ila” 4 aydan əskik müddətə aid deyil. Əgər “ila” andı verilsə, islam alimlərinin ittifaqına görə hökmü belədir: əgər 4 ay əsnasında kişi qadınına dönsə, gərək kəffarə verib ondan sonra qadını ilə cinsi əlaqədə olsun. Kəffarə üçün gərək ya bir qulam azad eləsin, ya 10 nəfər yoxsula libas, ya da yemək versin. Əgər 4 ay keçsə də, qadınına dönməsə, o vaxt hakim şəriətə əsasən hökm edər ki, ya dönsün, ya da qadını boşasın. Bu iki əmrdən birinə gərək hökmən əməl etsin. 4 ayın tamamında, ya ondan sonra əgər kişi qadınına dönsə, o zaman kəffarəyə ehtiyac yoxdur. (Tusi, Təhzib, VIII/2; İstibsar, III/252) Gələn ayədə “ila”-nın hökmünü bəyan edir)**.**

**226) (لِلَّذِينَ يُؤْلُونَ مِنْ نِسَآئِهِمْ) - o şəxslər ki qadınlarına “ila”** (andı) **edirlər,** (yəni cinsi əlaqəni tərk etmək haqqında and içirlər), **(تَرَبُّصُ اَرْبَعَةِ اَشْهُرٍ) - o kişilər 4 ay gözləyərlər.** (Çünki 4 aya qədər kişinin ixtiyarı var ki, əlaqədə olmasın, amma 4 aydan sonra əlaqədə olması vacibdir. Ancaq qadının izni ilə əlaqəni tərk edə bilər). **(فَاِنْ فَآؤُ) - əgər 4 ay tamam olmamış kəffarə verib, andı pozub, qadına dönsələr, (فَاِنَّ اللّٰهَ غَفُورٌ رَحِيمٌ) - həqiqətən, Allah-Təala onlara rəhm edib, “ila” səbəbinə qadınlara verdikləri zərərin günahını kəffarə verməklə onları bağışlayandır.**

**227) (وَاِنْ عَزَمُوا الطَّلَاقَ فَاِنَّ اللّٰهَ سَمِيعٌ عَلِيمٌ) - əgər qadına dönməyib, talaq vermək istəsələr, o vaxt ixtiyarları var ki, talaq versinlər, həqiqətən, Allah-Təala onların sözlərini eşidib, niyyətlərinə agahdır. Əgər məqsədləri qadına zərər vermək olsa, Allah-Təala onlardan intiqam alacaqdır.**

**228) (وَالْمُطَلَّقَاتُ) -** (bundan sonra gələn ayələr talaq ehkamını bəyan edir:) **talaq verilən aybaşı halındakı qadınlar, (يَتَرَبَّصْنَ بِاَنْفُسِهِنَّ ثَلٰثَةَ قُرُوٓءٍ) - talaqdan sonra 3 dəfə aybaşıdan pak olma zamanı özlərini gözləyib sonra ərə gedə bilərlər.** (Bu 3 dəfə pak olmaq aybaşı halındakı qadınlar haqqındakı talaq müddətidir)**. Elə ki 3 dəfə pak olma müddəti bitdi, o vaxt sərbəst olub ərə gedə bilərlər. (وَلَا يَحِلُّ لَهُنَّ) – talaq verilən qadınlara halal deyil ki, (اَنْ يَكْتُمْنَ مَا خَلَقَ اللّٰهُ فِيٓ اَرْحَامِهِنَّ) - Allah-Təalanın onların rəhmlərində yaratdığı şeyi gizlətsinlər.** (Yəni əgər talaq vaxtı onların rəhmlərində uşaq olsa, onu

اِنْ كُنَّ يُؤْمِنَّ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ وَبُعُولَتُهُنَّ اَحَقُّ بِرَدِّهِنَّ فٖي ذٰلِكَ اِنْ اَرَادُوٓا اِصْلَاحًا وَلَهُنَّ مِثْلُ الَّذٖي عَلَيْهِنَّ بِالْمَعْرُوفِۖ وَلِلرِّجَالِ عَلَيْهِنَّ دَرَجَةٌۜ وَاللّٰهُ عَزٖيزٌ حَكٖيمٌ ﴿٢٢٨﴾

---

gizlətməsinlər). **(اِنْ كُنَّ يُؤْمِنَّ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) - əgər o qadınlar Allah-Təalaya və qiyamət gününə iman gətirəndirlərsə, rəhmlərində olan uşağı gizlətməsinlər. (وَبُعُولَتُهُنَّ اَحَقُّ بِرَدِّهِنَّ فٖي ذٰلِكَ) – boşanmış qadınların onlara talaq verən ərləri,** (əgər talaq "ric\`i"* olsa) **"iddə"** (3 aybaşı müddəti) **zamanında** (qadınlarına) **dönməyə daha layiqdirlər. Yeni müqavilə olmadan yenidən onları özlərinə arvad edə bilərlər. (اِنْ اَرَادُوٓا اِصْلَاحًا) - əgər kişilərin qadınlarına dönməkdə məqsədi ailəni islah etmək və xoş güzəran keçirtmək olsa, o vaxt dönmək caizdir. Amma əgər dönməkdə məqsədləri qadına zərər vermək olsa, o vaxt dönmək caiz deyildir. (وَلَهُنَّ مِثْلُ الَّذٖي عَلَيْهِنَّ بِالْمَعْرُوفِ) – kişilərin qadınlar üzərində haqqı olduğu kimi, qadınların da kişilər üzərində haqqı vardır, gərək kişilər o haqqa riayət etsinlər. Kişinin, ya da qadının haqqı şəriətə və adət-ənənəyə görə gərək olsun.**

*(****Qeyd:*** Elə ki kişi qadını boşadı, nə qədər ki qadının "iddə"si tamam olmayıbdır, kişinin ixtiyarı var ki, qadına dönüb, yenə ər-arvad olsunlar, yeni nikah müqaviləsinə ehtiyacı yoxdur. Əvvəlki müqavilələri etibarlıdır. Belə talağa "ric\`i talaq" deyilir. Amma əgər qadın boşanmaq istəsə və boşansa, belə talağa "xul\`i talaq" (Tusi, Təhzib, VIII/95) deyilir və əgər hər iki tərəf boşanmaq istəsə, buna "mübarat talağı" deyilir. (Tusi, Təhzib, VIII/95) Bu son iki talaqda şərtdir ki, gərək qadın talağın əvəzində bir miqdar pul versin. Bu məbləğ nikah mehriyyəsindən* ***(kəbin haqqı)*** *artıq da ola bilər. Amma "mübarat talaq"da* ***(anlaşmalı boşanma)*** *həmin mehriyyə qədər pul versə, olar. Bu iki talaqda iddə əsnasında kişinin qadına dönmək ixtiyarı yoxdur. Elə ki bu iki talaq vaqe oldu, qadın kişidən ayrılmış olar. Amma əgər qadın verdiyi məbləği geri istəsə, talaq "ric\`i" sayılar. O vaxt kişinin də qadına dönməyə ixtiyarı olar). (Yəni necə ki kişinin haqqı vardır, qadın gərək o haqqa riayət edərək, kişiyə itaət edib, onun özünə, malına xəyanət etməsin. Habelə qadının da haqqı vardır, kişi də gərək o haqqa riayət etsin. Gərək qadına əziyyət etməsin, onun məişətini adət-ənənəyə görə təmin edib, onunla gözəl rəftar etsin. Hz. Peyğəmbər buyurubdur: "Mən bu dünyada üç şeyi sevirəm: Birincisi, ətriyyat, ikincisi, qadın, üçüncüsü, namaz" (Tirmizi, İşrətun-Nisa, 1; Əhməd bin Hənbəl, Müsnəd, III/128). Başqa bir hədisdə belə buyurub: "Ey camaat, Allah-Təaladan qorxun, qadınların haqqına riayət edin, onlar Allah-Təalanın əmanətidir" (Müslüm, Həc 19)).*

**(وَلِلرِّجَالِ عَلَيْهِنَّ دَرَجَةٌ) - amma kişilərin haqqı qadınlardan bir dərəcə artıqdır. (Çünki kişilər zəhmət çəkib onların məişətini təmin edir, qadınların istirahət etmələrinə şərait yaradırlar). (وَاللّٰهُ عَزٖيزٌ حَكٖيمٌ) - Allah-Təala məxluqata qalibdir. Bir şəxs başqasına zülm etsə, ya kişi qadına zülm etsə, Allah-Təala ondan hikmət üzrə intiqam alar.** (Ric\`i talaqda neçə dəfə boşanıb evlənmək olar, yoxsa bir həddi var məsələsini və onun həddini Allah-Təala sıradakı ayədə bəyan edir)**.**

اَلطَّلَاقُ مَرَّتَانِۖ فَاِمْسَاكٌ بِمَعْرُوفٍ اَوْ تَسْرِيحٌ بِاِحْسَانٍۜ وَلَا يَحِلُّ لَكُمْ اَنْ تَاْخُذُوا مِمَّٓا اٰتَيْتُمُوهُنَّ شَيْـًٔا اِلَّٓا اَنْ يَخَافَٓا اَلَّا يُقِيمَا حُدُودَ اللّٰهِۜ فَاِنْ خِفْتُمْ اَلَّا يُقِيمَا حُدُودَ اللّٰهِۙ فَلَا جُنَاحَ عَلَيْهِمَا فِيمَا افْتَدَتْ بِه۪ۜ تِلْكَ حُدُودُ اللّٰهِ فَلَا تَعْتَدُوهَاۚ وَمَنْ يَتَعَدَّ حُدُودَ اللّٰهِ فَاُو۬لٰٓئِكَ هُمُ الظَّالِمُونَ ﴿٢٢٩﴾ فَاِنْ طَلَّقَهَا فَلَا تَحِلُّ لَهُ مِنْ بَعْدُ

---

**229) (اَلطَّلَاقُ مَرَّتَانِ) – o talaq ki onda “iddə” əsnasında geri dönməyə ixtiyar var, o, iki dəfədir.** (Yəni şəxs qadını ilə “ric`i” talaqla boşansa, ondan sonra ixtiyarı var ki, “iddə”si bitənə qədər arvadına geri dönsün. Yeni müqavilə olmasa da, ilk “ric`i” talaqdan sonrakı evlilik batil olmaz. İlk nikah müqaviləsi səhihdir. Əgər döndükdən sonra ikinci dəfə yenə talaq versə, yenə “iddə” əsnasında geri dönə bilir. Bu oldu iki talaq. Əgər üçüncü dəfə talaq versə, daha qadına dönə bilməz. Necə ki buyurur:) (فَاِمْسَاكٌ بِمَعْرُوفٍ اَوْ تَسْرِيحٌ بِاِحْسَانٍ) **“İkinci talaqdan dönəndən sonra qadını yaxşı saxlayın, onlara zülm etməyin. Ya da boşamaq istəsəniz, yaxşılıqla boşayın, bu üçüncü talaqdan sonra sizin geri dönmək ixtiyarınız yoxdur. (وَلَا يَحِلُّ لَكُمْ) - ey kişilər, sizə halal deyil ki, (اَنْ تَاْخُذُوا مِمَّٓا اٰتَيْتُمُوهُنَّ شَيْـًٔا) - talaq verən vaxt qadınlara verdiyiniz mehriyyədən geri bir şey alasınız,** (burada “xul`i talağı” bəyan edir)**. (اِلَّٓا اَنْ يَخَافَٓا اَلَّا يُقِيمَا حُدُودَ اللّٰهِ) - ancaq kişi və qadın Allah-Təalanın təyin etdiyi hədləri və qanunları yerinə yetirməkdən qorxsalar, ya qadın itaətdən çıxar, ya da kişi də ona əziyyət edər, belə vaxtda qadın öz ixtiyarı ilə bir qədər pul verən, kişi də o məbləği alıb ona talaq verə bilər. (فَاِنْ خِفْتُمْ اَلَّا يُقِيمَا حُدُودَ اللّٰهِ) -** (bu ayə şəriət hakimlərinə xitabdır)**. Əgər siz hakimlər və qazılar ər və arvadın Allah-Təalanın qoyduğu qanunu yerinə yetirə bilməməsindən qorxsanız, o zaman (فَلَا جُنَاحَ عَلَيْهِمَا فِيمَا افْتَدَتْ بِه۪) - nə kişiyə* talaqdan ötrü pul almaqda, nə də qadına bir şey verib əvəzində boşanmaqda günah yoxdur.** (Belə halda siz hakimlər onları boşaya bilərsiniz)**. (تِلْكَ) - bu qeyd olunan hökmlər, (حُدُودُ اللّٰهِ) - Allah-Təalanın təyin etdiyi hədlərdir. (فَلَا تَعْتَدُوهَا) - bu hədləri aşıb kənara çıxmayın. (وَمَنْ يَتَعَدَّ حُدُودَ اللّٰهِ) - kim Allah-Təalanın təyin etdiyi hədləri aşsa, (فَاُو۬لٰٓئِكَ هُمُ الظَّالِمُونَ) - əlbəttə, onlar zalımdırlar.**

*(*Qeyd:* *Bir qadın ərinin evindən ayrılıb onun itaətindən çıxdı, kişi bu halını xəlifə Ömər ibn Xəttaba bəyan etdi. Ömər hökm verdi ki, qadın 3 gün bir xarabada (zibilxanada) yatsın. 3 gündən sonra qadını çağırıb soruşdu: “Yerin necə idi?” Qadın dedi: “Bu kişinin yanında olduğum müddətdə, bu 3 gecə kimi heç rahat yatmamışam”. Ondan sonra xəlifə kişiyə buyurdu: “Bütün malını sənə versə də, xul`i talaqla bu qadını boşa”).*

**230) (فَاِنْ طَلَّقَهَا) - əgər şəxs xanımına iki talaqdan sonra üçüncü talaq da versə, (فَلَا تَحِلُّ لَهُ مِنْ بَعْدُ) - talaq verəndən sonra o qadın o kişiyə haram olar. Daha o qadını ala bilməz.** (yəni elə ki şəxs öz xanımına 3 talaq verdi,

حَتّٰى تَنْكِحَ زَوْجًا غَيْرَهُ ط فَاِنْ طَلَّقَهَا فَلَا جُنَاحَ عَلَيْهِمَٓا اَنْ يَتَرَاجَعَٓا اِنْ ظَنَّٓا اَنْ يُقِيمَا حُدُودَ اللّٰهِ ط
وَتِلْكَ حُدُودُ اللّٰهِ يُبَيِّنُهَا لِقَوْمٍ يَعْلَمُونَ ﴿٢٣٠﴾ وَاِذَا طَلَّقْتُمُ النِّسَٓاءَ فَبَلَغْنَ اَجَلَهُنَّ فَاَمْسِكُوهُنَّ بِمَعْرُوفٍ اَوْ
سَرِّحُوهُنَّ بِمَعْرُوفٍ صلے وَلَا تُمْسِكُوهُنَّ ضِرَارًا لِتَعْتَدُوا ج وَمَنْ يَفْعَلْ ذٰلِكَ فَقَدْ ظَلَمَ نَفْسَهُ ط وَلَا تَتَّخِذُوٓا اٰيَاتِ
اللّٰهِ هُزُوًا ط وَاذْكُرُوا نِعْمَتَ اللّٰهِ عَلَيْكُمْ وَمَٓا اَنْزَلَ عَلَيْكُمْ مِنَ الْكِتَابِ وَالْحِكْمَةِ يَعِظُكُمْ بِهٖ ط وَاتَّقُوا اللّٰهَ وَاعْلَمُوٓا
اَنَّ اللّٰهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ع ﴿٢٣١﴾ وَاِذَا طَلَّقْتُمُ النِّسَٓاءَ فَبَلَغْنَ اَجَلَهُنَّ فَلَا تَعْضُلُوهُنَّ اَنْ يَنْكِحْنَ اَزْوَاجَهُنَّ

---

iki dəfə geri döndü, 3-cü talaq verəndən sonra o qadın daha ona halal olmaz). **(حَتّٰى تَنْكِحَ زَوْجًا غَيْرَهُ) – ta ki o qadın ilk ərindən başqasına ərə gedənə qədər. (**İkinci kişiyə ərə gedib, aralarında cinsi əlaqə olandan sonra kişi onu boşasa, ilk əri yenidən onu ala bilər). **(فَاِنْ طَلَّقَهَا) - əgər ikinci əri onu boşasa, talaqdan sonra, ( (فَلَا جُنَاحَ عَلَيْهِمَٓا) - o qadınla ilk ərinə günah yoxdur ki, (اَنْ يَتَرَاجَعَٓا اِنْ ظَنَّٓا اَنْ يُقِيمَا حُدُودَ اللّٰهِ) - qayıdıb ər-arvad olsunlar. Əgər zənn etsələr ki, Allah-Təalanın qoyduğu hədləri yerinə yetirəcəklər, bu qayıtmaq caizdir, (وَتِلْكَ حُدُودُ اللّٰهِ) - ər-arvadlıq haqqında bu qeyd olunanlar Allah-Təalanın hədləri və qanunlarıdır. (يُبَيِّنُهَا لِقَوْمٍ يَعْلَمُونَ) - o hədləri agah olan şəxslərdən ötrü bəyan edir ki, onlar da bilməyənlərə öyrətsinlər.**

**231) (وَاِذَا طَلَّقْتُمُ النِّسَٓاءَ) – o zaman ki qadınlarınıza** (ric`i) **talaq verdiniz, (فَبَلَغْنَ اَجَلَهُنَّ) – və onlar da talaqdan sonra "iddə"lərinin sonuna çatanda, (فَاَمْسِكُوهُنَّ بِمَعْرُوفٍ) - o vaxt əgər qadınlarınıza dönsəniz, onları yaxşı və gözəl şəkildə saxlayın. (اَوْ سَرِّحُوهُنَّ بِمَعْرُوفٍ) – ya da qoyun yaxşı və gözəl şəkildə qalsınlar, onlara dönməyin, ta ki "iddə"ləri bitib, öz ixtiyarlarında qalsınlar. (وَلَا تُمْسِكُوهُنَّ ضِرَارًا لِتَعْتَدُوا) - qadınlara zülm, zərər vermək məqsədi ilə dönüb onları saxlamayın. (وَمَنْ يَفْعَلْ ذٰلِكَ) - kim zərər yetirmək məqsədi ilə onlara dönsə, (فَقَدْ ظَلَمَ نَفْسَهُ) - həqiqətən, o şəxs özünə zülm edibdir. (وَلَا تَتَّخِذُوٓا اٰيَاتِ اللّٰهِ هُزُوًا) - Allah-Təalanın ayə və ehkamını istehzadan ötrü qəbul etməyin. Əksinə, əməl etməkdən ötrü qəbul edin. (وَاذْكُرُوا نِعْمَتَ اللّٰهِ عَلَيْكُمْ) - Allah-Təalanın o nemətlərini yadınıza salın ki, sizlərə bəxş edibdir.** (İslam dini, Hz. Məhəmmədin (s.ə.s), peyğəmbərliyi - bunlar Allah-Təalanın böyük nemətləridir). **(وَمَٓا اَنْزَلَ عَلَيْكُمْ) - və yadınıza salın o şeyi ki sizə nazil edibdir. (مِنَ الْكِتَابِ وَالْحِكْمَةِ) - Quran və hikmətlərdən o şeyi ki peyğəmbərin möcüzəli bəyanı ilə buyurubdur. (يَعِظُكُمْ بِهٖ) - Allah-Təala nazil etdiyi kitab və hikmətlərlə sizlərə öyüd-nəsihət edir. (وَاتَّقُوا اللّٰهَ) - təqvalı olub Allah-Təaladan qorxun. Qadınlara zülm etməyin. (وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) - bilin ki, həqiqətən, Allah-Təala hər bir şeydən agahdır.**

**232) (وَاِذَا طَلَّقْتُمُ النِّسَٓاءَ فَبَلَغْنَ اَجَلَهُنَّ) – o zaman ki qadınlara talaq verdiniz, onların "iddə"ləri tamamlandı, (فَلَا تَعْضُلُوهُنَّ اَنْ يَنْكِحْنَ اَزْوَاجَهُنَّ)** – (ey qadının hamiləri və qohum-əqrəbaları), **onları sıxışdırıb, boşandıqları ərlərilə**

اِذَا تَرَاضَوْا بَيْنَهُمْ بِالْمَعْرُوفِۜ ذٰلِكَ يُوعَظُ بِه۪ مَنْ كَانَ مِنْكُمْ يُؤْمِنُ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِۜ ذٰلِكُمْ اَزْكٰى لَكُمْ وَاَطْهَرُۜ وَاللّٰهُ يَعْلَمُ وَاَنْتُمْ لَا تَعْلَمُونَ ﴿٢٣٢﴾ وَالْوَالِدَاتُ يُرْضِعْنَ اَوْلَادَهُنَّ حَوْلَيْنِ كَامِلَيْنِ لِمَنْ اَرَادَ اَنْ يُتِمَّ الرَّضَاعَةَۜ وَعَلَى الْمَوْلُودِ لَهُ رِزْقُهُنَّ وَكِسْوَتُهُنَّ بِالْمَعْرُوفِۜ لَا تُكَلَّفُ نَفْسٌ اِلَّا وُسْعَهَاۚ لَا تُضَٓارَّ وَالِدَةٌ بِوَلَدِهَا وَلَا مَوْلُودٌ لَهُ بِوَلَدِه۪ وَعَلَى الْوَارِثِ مِثْلُ ذٰلِكَۚ فَاِنْ اَرَادَا فِصَالًا عَنْ تَرَاضٍ مِنْهُمَا وَتَشَاوُرٍ فَلَا جُنَاحَ عَلَيْهِمَاۜ وَاِنْ اَرَدْتُمْ اَنْ تَسْتَرْضِعُٓوا اَوْلَادَكُمْ

---

**təkrar nikahlanmalarına mane olmayın. (اِذَا تَرَاضَوْا بَيْنَهُمْ بِالْمَعْرُوفِ) – o zaman ki ər və qadın şəriətə uyğun gözəl şəkildə bir-birilərilə nikahlanmağa razı oldular, (ذٰلِكَ يُوعَظُ بِه۪) - bu sözlərlə onlara nəsihət edilər: (مَنْ كَانَ مِنْكُمْ يُؤْمِنُ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) - sizlərdən kim Allah-Təalaya və qiyamət gününə iman gətirsə, (ذٰلِكُمْ اَزْكٰى لَكُمْ وَاَطْهَرُ) - sizin bu hökmlərə əməl etməyiniz sizdən ötrü daha yaxşı və pakdır. (وَاللّٰهُ يَعْلَمُ) - sizin xeyriniz üçün necə hökmlər verməyə Allah-Təala agahdır, (وَاَنْتُمْ لَا تَعْلَمُونَ) - amma siz agah deyilsiniz, gərək Allah-Təalanın hökmlərinə tabe olasınız.**

**233) (وَالْوَالِدَاتُ يُرْضِعْنَ اَوْلَادَهُنَّ) - analar öz övladlarına süd verərlər, (حَوْلَيْنِ كَامِلَيْنِ) – tam iki il, (لِمَنْ اَرَادَ اَنْ يُتِمَّ الرَّضَاعَةَ) - bu iki il süd vermək o analardan ötrüdür ki, süd vermə müddətini tamamlamaq istəyirlər. Amma iki ildən əskik süd verməyə ixtiyar vardır, (وَعَلَى الْمَوْلُودِ لَهُ رِزْقُهُنَّ وَكِسْوَتُهُنَّ بِالْمَعْرُوفِ) - o şəxsə ki ondan ötrü uşağın baxımı ataya aiddir, anaların yeməyini və paltarını öz imaknına görə vermək lazımdır.** (Anaya talaq vermiş olsa da, gərək uşağın süd zamanında onların xərclərini ödəsinlər). **(لَا تُكَلَّفُ نَفْسٌ اِلَّا وُسْعَهَا) - süd verən anaların xərclərini ödəməkdə heç kimə** (ataya) **gücünün üstündə yük yüklənməz. (لَا تُضَٓارَّ وَالِدَةٌ بِوَلَدِهَا) - gərək ana** (ataya hirslənib süd verməyi tərk etməklə) **övladına zərər verməsin.** (Çünki heç kim uşağına anadan artıq mehriban ola bilməz). **(وَلَا مَوْلُودٌ لَهُ بِوَلَدِه۪) - ata da gərək süd zamanında anasından uşağı almaqla övladına zərər verməyib, onu anasından almasın. Əks təqdirdə həm uşağa, həm anasına zərər olar. (وَعَلَى الْوَارِثِ مِثْلُ ذٰلِكَ) - əgər ata ölsə, onun böyük olan varislərinə lazımdır ki, uşağa süd verən ananın xərcini atanın malından ödəsinlər. Ta ki süd vermə zamanı tamamlansın və xərcləri anadan almasınlar. Necə ki bu xərcləri atanın özünün verməsi lazım idi.** (Əgər ölünün böyük varisi olmasa, kiçik varislərin qəyyumu, ya da hakim şəriətə əsasən ölünün malından ananın xərclərini ödəməlidir). **(فَاِنْ اَرَادَا فِصَالًا عَنْ تَرَاضٍ مِنْهُمَا وَتَشَاوُرٍ) - əgər ata və ana hər ikisi iki il tamam olmadan uşağı süddən ayırmağa razılaşıb, belə istəsələr, (فَلَا جُنَاحَ عَلَيْهِمَا)- o vaxt ata-anaya heç bir günah yoxdur, (çünki uşağın xeyrini onlar daha yaxşı bilirlər. Ola bilər ki, tam iki il süd verilsə, bəzi səbəblərə görə uşağa zərər gəlsin). (وَاِنْ اَرَدْتُمْ اَنْ تَسْتَرْضِعُٓوا اَوْلَادَكُمْ) - əgər* siz atalar anadan başqa, uşağa süd verən dayə tutmaq istəsəniz,**

فَلا جُناحَ عَلَيْكُمْ اِذا سَلَّمْتُمْ مَآ اٰتَيْتُمْ بِالْمَعْرُوفِ وَاتَّقُوا اللّٰهَ وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ بِما تَعْمَلُونَ بَصيرٌ ﴿٢٣٣﴾
وَالَّذينَ يُتَوَفَّوْنَ مِنْكُمْ وَيَذَرُونَ اَزْواجًا يَتَرَبَّصْنَ بِاَنْفُسِهِنَّ اَرْبَعَةَ اَشْهُرٍ وَعَشْرًا فَاِذا بَلَغْنَ اَجَلَهُنَّ فَلا
جُناحَ عَلَيْكُمْ فيما فَعَلْنَ فيٓ اَنْفُسِهِنَّ بِالْمَعْرُوفِ وَاللّٰهُ بِما تَعْمَلُونَ خَبيرٌ ﴿٢٣٤﴾ وَلا جُناحَ عَلَيْكُمْ
فيما عَرَّضْتُمْ بِه مِنْ خِطْبَةِ النِّسآءِ

---

*(***Qeyd:** Hər kəs öz uşağından ötrü dayə tutanda gərək gözəl, ağıllı, iffət və ədəb sahibi bir qadını seçsin. Uşaq süd verən qadının südüylə böyüdüyünə görə, o qadının bütün xasiyyətləri o uşaqda ortaya çıxar. Uşağın tərbiyəsində əsas rol anaya məxsus olduğuna görə, gərək, analar ağıllı və ədəbli olsunlar. Müsəlman qadını dayə tutmaq caiz olduğu kimi, habelə əhli-kitab - yəhudi və xristian dayə tutmaq da caizdir).*

(ana süd verməyə qabil olmadıqda), **(فَلَا جُنَاحَ عَلَيْكُمْ) - siz ataların övladınızdan ötrü dayə tutmağınızda heç bir günah yoxdur, (اِذَا سَلَّمْتُمْ مَآ اٰتَيْتُمْ بِالْمَعْرُوفِ) – dayələrin haqqını gözəl şəkildə ödəyib, onlara əziyyət etmədiyiniz təqdirdə. (وَاتَّقُوا اللّٰهَ) - Allah-Təaladan qorxub, dayələrin haqqını kəsməyin. (وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ بِمَا تَعْمَلُونَ بَصِيرٌ) – bilin ki, Allah-Təala etdiyiniz hər bir əməldən agahdır.**

**234) (وَالَّذِينَ يُتَوَفَّوْنَ مِنْكُمْ) - sizlərdən kim vəfat edib, (وَيَذَرُونَ اَزْوَاجًا) - özündən sonra xanımını qoyub getsə,** (özləri ölüb, arvadları qalsa), **(يَتَرَبَّصْنَ بِاَنْفُسِهِنَّ اَرْبَعَةَ اَشْهُرٍ وَعَشْرًا) - ərləri ölən qadınlar özlərini gözləyib 4 ay 10 gün** (evlənməyib) **"iddə" saxlayarlar.** (Bu hökm əri ölən hər bir qadına şamildir, qadın aybaşılı (heyzli) olsa, ya heyzdən kəsilsə, kiçik, ya da böyük olsa, əri ilə cinsi əlaqədə olmuş olsa, ya olmasa, fərqi yoxdur, elə ki əri öldü, gərək 4 ay 10 gün iddə saxlasın. 4 ay 10 gün içində ərə gedə bilməzlər). **(فَاِذَا بَلَغْنَ اَجَلَهُنَّ) - o zaman ki "iddə"ləri bitdi, (فَلَا جُنَاحَ عَلَيْكُمْ فِيمَا فَعَلْنَ فِيٓ اَنْفُسِهِنَّ بِالْمَعْرُوفِ)** – (ey şəriət hakimləri və müsəlmanlar)**, iddələri bitmiş qadınlar özləri haqqında şəriətə müvafiq nə etsələr, sizə heç bir günah yoxdur.** (Yəni iddələri tamam olandan sonra əgər şəriətə müvafiq şəkildə ərə getsələr, buna ixtiyarları var, bundan sizə bir günah yoxdur və ərə getməkdə onlara mane ola bilməzsiniz). **(وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ) - Allah-Təala etdiyiniz şeylərdən xəbərdar və agahdır. "İddə" əsnasında qadınları nikahlamayın. İddəsi bitəndən sonra ərə getmələrinə mane olmayın.** (İddəsi bitməmiş qadınla nikahlanmaq istəmək və onlara demək ki, sənin iddən bitəndən sonra mən səni alacağam, (iddə talaq iddəsi olsun, ya vəfat iddəsi, fərqi yoxdur), bu sözü onlara aşkar demək haramdır. Amma rəmz ilə demək olar ki, qadın sənin onu istədiyini anlasın, ta ki başqa bir şəxsi seçməsin, bu, caizdir. Bu hökmü sıradakı ayədə bəyan edir).

**235) (وَلَا جُنَاحَ عَلَيْكُمْ فِيمَا عَرَّضْتُمْ بِهِ مِنْ خِطْبَةِ النِّسَآءِ)* - iddə içində olan qadınları istədiyinizi onlara rəmz** (işarə) **ilə deməkdə sizə heç bir günah yoxdur.**

*(***Qeyd:** Abdullah ibn Mübarək Əbdürrəhman ibn Süleymandan, o da xalasından rəvayət edir. Xalası deyir: "Mən iddə əsnasında olan zaman imam Əbu Cəfər (Mə-*

اَوْ اَكْنَنْتُمْ فٖيٓ اَنْفُسِكُمْؕ عَلِمَ اللّٰهُ اَنَّكُمْ سَتَذْكُرُونَهُنَّ وَلٰكِنْ لَا تُوَاعِدُوهُنَّ سِرًّا اِلَّٓا اَنْ تَقُولُوا قَوْلًا مَعْرُوفًاؕ وَلَا تَعْزِمُوا عُقْدَةَ النِّكَاحِ حَتّٰى يَبْلُغَ الْكِتَابُ اَجَلَهُؕ وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ يَعْلَمُ مَا فٖيٓ اَنْفُسِكُمْ فَاحْذَرُوهُۚ وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ غَفُورٌ حَلٖيمٌ ﴿٢٣٥﴾

---

*həmməd Bağır) mənim yanıma gəlib dedi: "Mənim Hz. Peyğəmbərə yaxınlığımı və islamdakı dərəcəmi bilirsən". Mən ona dedim: "Allah-Təala səni bağışlasın, bəs sən mənə evlilik təklif edirsən? Halbuki mənim iddəm tamam olmayıbdır. Allah-Təala səni cəzalandırar". O həzrət dedi: "Mən sənə evlilik təklif etdim? Mən sənə peyğəmbərə olan yaxınlığımı, islamdakı dərəcəmi deyib məlum etdim". Ümmü Sələmənin əri Əbu Sələmə vəfat edəndən sonra Hz. Peyğəmbər onun yanına gedib özünün məqam və mərtəbəsini ondan ötrü qeyd etdi. Özü də elə bir halda ki, o, həsirə yaslanmışdı, hətta həsir onun bədəninə təsir edirdi, bununla belə, o söz evlilik təklifi olmadı, mən deyən oldu?")*

(Məsələn, bir şəxs iddə içində olan qadına belə desə: "Sən yaxşı bir qadınsan, mən Allah-Təaladan arzu edirəm ki, mənə belə bir saleh qadın versin", - belə söz demək caizdir. Ta ki o qadın anlasın ki, bu şəxs onu istəyir. İddədən çıxandan sonra özgə şəxsi seçməsin. Amma açıq-aşkar demək caiz deyildir) **(اَوْ اَكْنَنْتُمْ فٖيٓ اَنْفُسِكُمْ وَلَا تَعْزِمُوا عُقْدَةَ النِّكَاحِ) – ya da gizlicə iddə içindəki qadınları istəmənizdə və iddələri bitəndən sonra onları almağı xəyal etmənizdə yenə sizə bir günah yoxdur. (عَلِمَ اللّٰهُ اَنَّكُمْ سَتَذْكُرُونَهُنَّ) - Allah-Təalaya agahdır ki, siz iddədə olan o qadınları yad edib onları almaq barəsində sözlər danışırsınız, bundan sizə bir günah yoxdur. (وَلٰكِنْ لَا تُوَاعِدُوهُنَّ سِرًّا) - amma iddədə olan qadınlara gizlin vəd verib onlara deməyin: mən səni alacağam, gör səni necə saxlayacağam, qadın da deməsin: mən də əlbəttə, sənə gedəcəyəm. Bu sözlər haramdır. (اِلَّٓا اَنْ تَقُولُوا قَوْلًا مَعْرُوفًا) – qadınlara ancaq o sözü deyin ki, şəriətdə caizdir.** (Necə ki yuxarıda keçdi, rəmz ilə demək caizdir). **(وَلَا تَعْزِمُوا عُقْدَةَ النِّكَاحِ - iddə əsnasında nikah müqaviləsi bağlamağa çalışmayın. (حَتّٰى يَبْلُغَ الْكِتَابُ اَجَلَهُ) – qoy yazılıb vacib olan iddə öz vaxtını tamamlasın, (iddələri tamam olsun, o vaxt nikahlayın). (وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ يَعْلَمُ مَا فٖيٓ اَنْفُسِكُمْ) - bilin ki, Allah-Təala içinizdəki şeyə agahdır. İddə əsnasındakı qadınları almaq istəyirsiniz. (فَاحْذَرُوهُ) - belə əməldən çəkinib kənar olun. (وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ غَفُورٌ حَلٖيمٌ) - bunu da bilin ki, əgər belə bir xilaf əməl sizdən meydana gəlib, ondan sonra tövbə etsəniz, Allah-Təala tövbə edənləri bağışlayıb onlara əzab etməkdə tələsən deyildir.** (Əgər bir şəxs qadınla evlənəndə, nikah müqaviləsində mehriyyəni qeyd etməsə, cinsi əlaqədən əvvəl qadına talaq versə, o qadına mehriyyə lazım deyil. Gərək ona bəxşiş versin. Amma əgər cinsi əlaqədən sonra talaq versə, gərək ona mehriyyənin mislini - yəni özü kimi olan qadınların mehriyyəsi qədər versin. Əgər nikah müqaviləsində mehriyyəni qeyd edib, ondan sonra cinsi əlaqədən əvvəl talaq versə, gərək o mehriyyənin yarısını versin. Necə ki sıradakı ayədə bəyan edilir).

لَا جُنَاحَ عَلَيْكُمْ اِنْ طَلَّقْتُمُ النِّسَآءَ مَا لَمْ تَمَسُّوهُنَّ اَوْ تَفْرِضُوا لَهُنَّ فَرِيضَةً ۚ وَمَتِّعُوهُنَّ ۚ عَلَى الْمُوسِعِ
قَدَرُهُ وَعَلَى الْمُقْتِرِ قَدَرُهُ ۚ مَتَاعًا بِالْمَعْرُوفِ ۚ حَقًّا عَلَى الْمُحْسِنِينَ ﴿٢٣٦﴾ وَاِنْ طَلَّقْتُمُوهُنَّ مِنْ قَبْلِ اَنْ
تَمَسُّوهُنَّ وَقَدْ فَرَضْتُمْ لَهُنَّ فَرِيضَةً فَنِصْفُ مَا فَرَضْتُمْ اِلَّا اَنْ يَعْفُونَ اَوْ يَعْفُوَا الَّذِي بِيَدِهِ عُقْدَةُ النِّكَاحِ ۚ وَاَنْ
تَعْفُوا اَقْرَبُ لِلتَّقْوٰى ۚ وَلَا تَنْسَوُا الْفَضْلَ بَيْنَكُمْ ۚ اِنَّ اللّٰهَ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿٢٣٧﴾ حَافِظُوا عَلَى الصَّلَوَاتِ

---

**236) (لَا جُنَاحَ عَلَيْكُمْ) - qadınların mehriyyəsi barəsində sizə heç bir günah yoxdur və mehriyyə sizə lazım deyil, -(اِنْ طَلَّقْتُمُ النِّسَآءَ) - əgər qadınlara talaq versəniz, (مَا لَمْ تَمَسُّوهُنَّ) - onlarla cinsi əlaqədə olmadınızsa, mehriyyəni təyin etmədən qabaq,** (çünki nikah müqaviləsində mehriyyəni qeyd etmək lazım deyil, bunsuz da nikah müqaviləsi caizdir. Nə zaman ki mehriyyə təyin edilmədən nikah bağlandı və kişi qadınla cinsi əlaqədən əvvəl ona talaq verdi, o zaman kişinin qadına mehriyyə verməsi lazım deyil). **(اَوْ تَفْرِضُوا لَهُنَّ فَرِيضَةً) - ancaq o qadınlara mehriyyə təyin etmisinizsə, hansı ki cinsi əlaqədən əvvəl onlara talaq verirsiniz, o zaman o mehriyyənin yarısını onlara vermək lazımdır. (وَمَتِّعُوهُنَّ) -** (amma əgər mehriyyə təyin edilməyib, cinsi əlaqədən əvvəl talaq verilsə), **o zaman onlara elə bir şey verin ki, ondan mənfəət əldə etsinlər. Bir dəst libas, ya bir qədər pul, gərək mütləq bir şey bəxşiş verilsin. (عَلَى الْمُوسِعِ قَدَرُهُ) - bu bəxşiş varlı şəxsə öz halına görə lazımdır.** (وَعَلَى الْمُقْتِرِ قَدَرُهُ) **kasıba imkanı dairəsində lazımdır (مَتَاعًا بِالْمَعْرُوفِ) - bu bəxşiş həm şəriətə, həm insaf-mürüvvətə görə, gərək gözəl şəkildə verilsin.** (Çünki mehriyyə təyin edilməsə də, kişi qadını ilə bir yerdə olub, ya da nikah bağlandığı üçün o qadın o kişinin xanımı hesab olunubdur, talaq vaxtı gərək ona bir şey verilsin). **(حَقًّا عَلَى الْمُحْسِنِينَ) - bu bəxşiş qadınlarına talaq verən şəxslərin üzərində bir haqdır.**

**237) (وَاِنْ طَلَّقْتُمُوهُنَّ) - əgər qadınları boşasanız, (مِنْ قَبْلِ اَنْ تَمَسُّوهُنَّ) - onlarla əlaqədən qabaq, (وَقَدْ فَرَضْتُمْ لَهُنَّ فَرِيضَةً) - amma bir halda ki onlardan ötrü bir qədər mehriyyə təyin etmiş olasınız, (فَنِصْفُ مَا فَرَضْتُمْ) - o vaxt təyin etdiyiniz mehriyyənin yarısını, gərək, onlara verəsiniz. (اِلَّا اَنْ يَعْفُونَ) - ancaq boşanan qadınlar özləri o yarım mehriyyəni bağışlasalar, (اَوْ يَعْفُوَا الَّذِي بِيَدِهِ عُقْدَةُ النِّكَاحِ) – ya da nikah müqaviləsinin ixtiyarı öz əlində olan şəxs o yarım mehriyyəni bağışlasa,** (nikah müqaviləsində ixtiyarı olan şəxs ya vəlidir, ya da vəkildir. Qadının vəlisi atadır, ya da babadır, əgər vəli, ya da vəkil o yarım mehriyyəni ərdən almayıb bağışlasa, caizdir). **(وَاَنْ تَعْفُوا اَقْرَبُ لِلتَّقْوٰى) - sizin bir-birinizi bağışlayıb əfv etməyiniz təqvaya daha yaxındır. (وَلَا تَنْسَوُا الْفَضْلَ بَيْنَكُمْ) - öz aranızda güzəşt və ehsan etməyi yadınızdan çıxartmayın. (اِنَّ اللّٰهَ بِمَا تَعْمَلُونَ بَصِيرٌ) - həqiqətən, Allah-Təala etdiyiniz şeyləri görür və bilir. Siz bir-birinizə güzəşt və ehsan etdiyiniz kimi, Allah-Təala da sizə güzəşt edər.**

**238) (حَافِظُوا عَلَى الصَّلَوَاتِ) - bütün* namazlara davam edin,**

*(****Qeyd:*** *Talaq və iddə ehkamlarını ehtiva edən iki ayədən danışarkən namaz ehkamını qeyd etməkdə nə hikmət vardır? Cavab: keçən ayənin axırında buyurduğu*

وَالصَّلٰوةِ الْوُسْطٰى وَقُومُوا لِلّٰهِ قَانِتِينَ ﴿٢٣٨﴾ فَاِنْ خِفْتُمْ فَرِجَالًا اَوْ رُكْبَانًاۚ فَاِذَٓا اَمِنْتُمْ فَاذْكُرُوا اللّٰهَ كَمَا عَلَّمَكُمْ مَا لَمْ تَكُونُوا تَعْلَمُونَ ﴿٢٣٩﴾

---

*kimi: -(وَلَا تَنْسَوُا الْفَضْلَ بَيْنَكُمْ) " bir-birinizə güzəşt və ehsan etməyi yadınızdan çıxartmayın," (Bəqərə, 2/237) - hökmünün arxasınca iki ayədə namazı qeyd etmək buna işarədir ki, hərçənd güzəşt və ehsan etmək yaxşı əməldir, amma əməllərin ən yaxşısı namazdır. Çünki onda Allah-Təalaya qulluq və Onun qarşısında zillət vardır. Bəs hər bir xeyir əməldə namazı yadınıza gətirib və ona yaxşılıqla davam edin, çünki bütün ibadətlərin başında namaz gəlir. Əgər desəniz ki, qorxu içində namaz qılmaq mümkün olmaz, o vaxt sizə izin verilir ki, necə mümkün olsa, hətta işarə ilə də olsa, elə namaz qılın. Əgər mümkün olsa, bir dəfə qibləyə yönəlib, ancaq təkbir deyib Allah-Təalanı zikr etmək kifayət edər. Hz. Əli (ə.s), Sıffin savaşı əsnasında neçə dəfə namazı işarə ilə qıldı. (Tusi, Təhzib, III/173) Taif əhli peyğəmbərin hüzuruna gəlib ərz etdi: "ey peyğəmbər, sənə iman gətiririk, bu şərtlə ki, namaz olmasın". Buyurdu: "Bir camaat ki onlarda namaz olmasın, mənə lazım deyildir". (Əhməd b. Hənbəl, IV, 218) Ey müsəlmanlar, bir bu hədisə baxıb görün, uca peyğəmbərimiz namaz qılmayan şəxslərdən necə üz çevirib, onların imanını istəmir. Bu namazda böyük hikmətlər vardır. Axirət savabından başqa, dünyada da din və ümmətin tərəqqisinə baisdir. Çünki namazın əsli camaatla qılınmaqdadır. Camaatda böyük fayda və mənfəətlər vardır. Namazı tərk edən müsəlmanlara nicat yoxdur. Dünyada zəlil və axirətdə binəsib olacaqlar. Böyük xristian üləmaları və şairləri bu namazdan ötrü necə təriflər və şeirlər deyiblər. Əgər onlara agah olmaq istəsəniz, Böyük Britaniyanın ingilis mənşəli şeyxülislamı olan Şeyx Abdullah Küveyliyamın yazdığı "əl-Əqidətül-islamiyyə" kitabına baxın (Misirdə 1897-ci ildə çap olunmuş bu əsər "əl-Əqidətul-İslamiyyə zikru şəhadətil-üləma və Avropa" olub İslam ölkələrinin bəzi mərkəzi kitabxanalarında mövcuddur), o kitabda islamın həqiqəti və namaz barəsində xristian üləmalarından nəql olunan xütbələr və şeirlərdən agah olub, ibrət alarsınız. Bu şəxs 1887-ci ildə Livirpul şəhərində islamı qəbul edib və 1888-ci ildə bu kitabı yazıbdır. Allah ona rəhmət etsin).*

**Yaxşıca qılın. (وَالصَّلٰوةِ الْوُسْطٰى) – xüsusilə, əsr namazını ki, onun fəziləti bütün namazlardan artıqdır. (وَقُومُوا لِلّٰهِ قَانِتِينَ) - namaz vaxtı Allah-Təaladan ötrü ayaq üstündə durub ibadət edin, elə bir halda ki, Allah-Təalanı zikr edən olasınız.**

**239) (فَاِنْ خِفْتُمْ) - Əgər namaz qılan zaman düşməndən qorxsanız, o vaxt sizdən ötrü namaz qılmaqda sərbəstlik vardır. (فَرِجَالًا اَوْ رُكْبَانًا) - ayaq üstündə, ya da süvari və heyvan üstündə olan halda namaz qılın. (فَاِذَٓا اَمِنْتُمْ) – nə zaman ki düşməndən əmin-amanlıqda oldunuz, (فَاذْكُرُوا اللّٰهَ كَمَا عَلَّمَكُمْ) - o vaxt Allah-Təalanı zikr edib namaz qılın, necə ki Allah-Təala sizə təlim edibdir. Əmin-amanlıqda olan vaxt gərək namazı o şəkildə qılasınız. (مَا لَمْ تَكُونُوا تَعْلَمُونَ) - Allah-Təala sizə namaz qılmağı öyrətdi, hansı ki namaz qılmağa siz agah deyildiniz.**

وَالَّذِينَ يُتَوَفَّوْنَ مِنْكُمْ وَيَذَرُونَ اَزْوَاجًاۚ وَصِيَّةً لِاَزْوَاجِهِمْ مَتَاعًا اِلَى الْحَوْلِ غَيْرَ اِخْرَاجٍۚ فَاِنْ خَرَجْنَ
فَلَا جُنَاحَ عَلَيْكُمْ فِي مَا فَعَلْنَ فِيٓ اَنْفُسِهِنَّ مِنْ مَعْرُوفٍۜ وَاللّٰهُ عَزِيزٌ حَكِيمٌ ﴿٢٤٠﴾ وَلِلْمُطَلَّقَاتِ مَتَاعٌ
بِالْمَعْرُوفِۜ حَقًّا عَلَى الْمُتَّقِينَ ﴿٢٤١﴾ كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمْ اٰيَاتِهِ لَعَلَّكُمْ تَعْقِلُونَ ﴿٢٤٢﴾ اَلَمْ تَرَ اِلَى
الَّذِينَ خَرَجُوا مِنْ دِيَارِهِمْ وَهُمْ اُلُوفٌ حَذَرَ الْمَوْتِۖ فَقَالَ لَهُمُ اللّٰهُ مُوتُوا ثُمَّ اَحْيَاهُمْۜ

---

**240) (وَالَّذِينَ يُتَوَفَّوْنَ مِنْكُمْ) - sizlərdən kim vəfat edib, (وَيَذَرُونَ اَزْوَاجًا) - özlərindən sonra arvadlarını qoyub gedir, (وَصِيَّةً لِاَزْوَاجِهِمْ) - ölən vaxtı arvadlarından ötrü vəsiyyət etsin ki, (مَتَاعًا اِلَى الْحَوْلِ) - qadınlara onun malından bir il müddətinə kimi xərclik, libas və mənzil verilsin. (غَيْرَ اِخْرَاجٍ فِي) - o vaxt varislər o qadını bir il tamam olmadan evdən çıxara bilməzlər. (فَاِنْ خَرَجْنَ) - əgər onlar öz ixtiyarları ilə çıxsalar, (فَلَا جُنَاحَ عَلَيْكُمْ) – o vaxt sizə heç bir günah yoxdur, (مَا فَعَلْنَ فِيٓ اَنْفُسِهِنَّ مِنْ مَعْرُوفٍ) – özləri üçün şəriətə müvafiq olan şeyləri etməkdə,** (bu halda onlara xərclik və libas da verilməz)**. (وَاللّٰهُ عَزِيزٌ حَكِيمٌ) - Allah-Təala məxluqata qalibdir və onlarla hikmət üzrə rəftar edəndir.**

**241) (وَلِلْمُطَلَّقَاتِ) - boşanan qadınlara (مَتَاعٌ بِالْمَعْرُوفِ) - iddə zamanı şəriətə müvafiq xərclik vermək vacibdir. (حَقًّا عَلَى الْمُتَّقِينَ) - bu xərcliyi vermək müttəqi olan kişilərin üzərinə haqdır, gərək iddə xərcini versinlər.**

**242) (كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمْ اٰيَاتِهِ لَعَلَّكُمْ تَعْقِلُونَ) - habelə Allah-Təala sizdən ötrü öz hökmlərini bəyan edir, bəlkə, ağlınız ilə o hökmlərin yaxşılığını dərk edib onlara əməl edəsiniz.** (Sıradakı ayədə Allah-Təala öz möcüzələrindən bir möcüzəni bəyan edir)**.**

**243) (اَلَمْ تَرَ) -** (ey Məhəmməd)**, baxıb öyrənmirsən ki,** (yəni əlbəttə baxıb öyrən), **(اِلَى الَّذِينَ) - o şəxslərin əhvalını ki (خَرَجُوا مِنْ دِيَارِهِمْ) - öz* yurdlarından çıxdılar, (وَهُمْ اُلُوفٌ) – elə bir halətdə ki, neçə min nəfər idilər. (حَذَرَ الْمَوْتِ)- bu çıxmaları ölüm qorxusundan idi. (Ərəbistanda Kufəyə yaxın Vasit bölgəsində Davərdan adlı bir qəsəbə var idi. Orada taun xəstəliyi yayıldı. Qəsəbə əhli tamamən ölmək qorxusundan oradan çıxıb qaçdılar). (فَقَالَ لَهُمُ اللّٰهُ مُوتُوا)- Allah-Təala onlara əmr etdi ki, hamınız ölün. Hamısı öldü. (ثُمَّ اَحْيَاهُمْ) - bir müddət sonra onlara həyat verib diriltdi.** (Ta ki agah olsunlar ki, Allah-Təalanın hikmətindən qaçmaq olmaz).

*(*Qeyd:* ***Qeyd:*** *Hz. Peyğəmbər (s.ə.s), buyurdu: "Hansı məkanda taun, ya da vəba vaqe olsa, oradan çıxmayın və əgər elə bir yerdə vaqe olsa ki, siz orada deyilsiniz, o yerə daxil olmayın". Hz. Peyğəmbər nə qədər doğru buyurmuşdur. 1300 il bundan əvvəl buyurduğu söz – xəstəlik zamanında karantinin olmasının faydası indi məlum olur. İslam ümməti belə bir həzrətlə gərək fəxr etsin. Ömər əl-Faruq Mədinədən Şama gedirdi, yol əsnasında eşitdi ki, Şamda vəba xəstəliyi var. Yoldaşlarını toplayıb, onlarla məşvərət etdi. Hərəsi bir söz dedi. Səhabələrdən biri gəlib bu hədisi nəql etdi.*

اِنَّ اللّٰهَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَشْكُرُونَ ﴿٢٤٣﴾ وَقَاتِلُوا فٖي سَبٖيلِ اللّٰهِ وَاعْلَمُوٓا
اَنَّ اللّٰهَ سَمٖيعٌ عَلٖيمٌ ﴿٢٤٤﴾ مَنْ ذَا الَّذٖي يُقْرِضُ اللّٰهَ قَرْضًا حَسَنًا فَيُضَاعِفَهُ لَهُ اَضْعَافًا كَثٖيرَةً وَاللّٰهُ
يَقْبِضُ وَيَبْصُطُ وَاِلَيْهِ تُرْجَعُونَ ﴿٢٤٥﴾ اَلَمْ تَرَ اِلَى الْمَلَاِ مِنْ بَنٖيٓ اِسْرَٓاءٖيلَ مِنْ بَعْدِ مُوسٰى اِذْ قَالُوا
لِنَبِيٍّ لَهُمُ ابْعَثْ لَنَا مَلِكًا نُقَاتِلْ فٖي سَبٖيلِ اللّٰهِ قَالَ هَلْ عَسَيْتُمْ اِنْ كُتِبَ عَلَيْكُمُ الْقِتَالُ اَلَّا تُقَاتِلُوا قَالُوا
وَمَا لَنَٓا اَلَّا نُقَاتِلَ فٖي سَبٖيلِ اللّٰهِ وَقَدْ اُخْرِجْنَا مِنْ دِيَارِنَا وَاَبْنَٓائِنَا

---

*Həmin vaxt Ömər əmr etdi ki, Mədinəyə qayıtsınlar. Bu vaxt Əbu Ubeydə ona dedi: "Ey Ömər! Allahın qədərindən qaçırsan? O da: "Bəli Allahın qədərindən yenə Allahın qədərinə qaçıram" dedi. (Buxari, Tibb, 30 Ənbiya, 50; Müslüm, Salam, 92)).*

(اِنَّ اللّٰهَ لَذُو فَضْلٍ عَلَى النَّاسِ) - **həqiqətən, Allah-Təala xalqa lütf və ehsan sahibidir.** (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَشْكُرُونَ) **- amma insanların əksəriyyəti Allah-Təalaya şükür edən deyil.**

**244) (وَقَاتِلُوا فٖي سَبٖيلِ اللّٰهِ وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ سَمٖيعٌ عَلٖيمٌ) - indi ki ölüm insana hər bir zaman gələcək, Allah-Təala yolunda müşriklərlə cihad edin. Bilin ki, Allah-Təala cihadı tərk edənlərin sözlərini eşidib qəlblərdə olan sirlərə agahdır.**

**245) (مَنْ ذَا الَّذٖي) - kimdir sizdən o şəxs ki, (يُقْرِضُ اللّٰهَ قَرْضًا حَسَنًا) - Allah-Təalaya gözəl olan borc versin?** (Yəni varlı şəxs yoxsula kömək olub onun ehtiyacını həll etmək üçün ondan faiz almayıb ona gözəl borc versin. O borc Allah-Təalaya olan borc hesab olunur. Varlılardan ötrü nə böyük dərəcədir ki, millətin yoxsul fərdlərinə borc verməklə Allah-Təalanı özlərinə borclu etsinlər). **(فَيُضَاعِفَهُ لَهُ) - Allah-Təala onun verdiyi borcunun əvəzini ondan ötrü artırar, (اَضْعَافًا كَثٖيرَةً) - çox-çox artırar. (وَاللّٰهُ يَقْبِضُ وَيَبْصُطُ) - Allah-Təala öz bəndələrindən kimə istəsə, sıxıntı verər kimə istəsə, genişlik** (bolluq) **verər.** (Allah-Təalanın əmri ilə bolluq içində olan şəxsin sıxıntı içində olan şəxsə yardım etməsi lazımdır). **(وَاِلَيْهِ تُرْجَعُونَ) - hamınız Allah-Təalaya qayıdacaqsınız.**

**246) (اَلَمْ تَرَ)** – (ey Məhəmməd), **bəs baxmırsan və öyrənmirsən? (Yəni əlbəttə, gərək, öyrənəsən), (اِلَى الْمَلَاِ) - şərəfli və böyük olan şəxslərin əhvalatını. (مِنْ بَنٖيٓ اِسْرَٓاءٖيلَ مِنْ بَعْدِ مُوسٰى) - Musadan sonra bəni-İsrail, (اِذْ قَالُوا لِنَبِيٍّ لَهُمُ ابْعَثْ لَنَا مَلِكًا) - özlərindən ötrü göndərilən peyğəmbərə,** (Samuel peyğəmbərə) **dedilər: bizdən ötrü bir padşah təyin et, (نُقَاتِلْ فٖي سَبٖيلِ اللّٰهِ) ta ki onun rəhbərliyi ilə Allah-Təala yolunda cihad edək. (قَالَ هَلْ عَسَيْتُمْ اِنْ كُتِبَ عَلَيْكُمُ الْقِتَالُ اَلَّا تُقَاتِلُوا)** - (Samuel peyğəmbər onlara dedi:) **ümid edirsiniz, bəs cihad etmək sizə yazılıb vacib olanda, bəlkə, Allah-Təala yolunda cihad etməzsiniz? (قَالُوا) - cavabında dedilər: (وَمَا لَنَٓا اَلَّا نُقَاتِلَ فٖي سَبٖيلِ اللّٰهِ) - nə olubdur bizə ki, Allah-Təala yolunda cihad etməyək? (وَقَدْ اُخْرِجْنَا مِنْ دِيَارِنَا وَاَبْنَٓائِنَا)**

فَلَمَّا كُتِبَ عَلَيْهِمُ الْقِتَالُ تَوَلَّوْا اِلَّا قَلِيلًا مِنْهُمْ وَاللّٰهُ عَلِيمٌ بِالظَّالِمِينَ ﴿٢٤٦﴾ وَقَالَ لَهُمْ نَبِيُّهُمْ اِنَّ اللّٰهَ
قَدْ بَعَثَ لَكُمْ طَالُوتَ مَلِكًا قَالُوٓا اَنّٰى يَكُونُ لَهُ الْمُلْكُ عَلَيْنَا وَنَحْنُ اَحَقُّ بِالْمُلْكِ مِنْهُ وَلَمْ يُؤْتَ سَعَةً
مِنَ الْمَالِ قَالَ اِنَّ اللّٰهَ اصْطَفٰيهُ عَلَيْكُمْ وَزَادَهُ بَسْطَةً فِي الْعِلْمِ وَالْجِسْمِ وَاللّٰهُ يُؤْتِي مُلْكَهُ مَنْ يَشَآءُ
وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ ﴿٢٤٧﴾ وَقَالَ لَهُمْ نَبِيُّهُمْ

---

**- halbuki biz yurdlarımızdan çıxarılıb, oğullarımızdan uzaqlaşdırılmışıq.** (Yəni düşmən gəlib bizi yurdumuzdan qovub, oğullarımızı əsir edibdir). (Calut və ya Qolyat bir padşah idi, dəniz kənarında Misir ilə Fələstin arasında hökm sürürdü, bəni-İsraili yurdlarından qovub, böyüklərindən 440 nəfərin oğullarını əsir etdi). **(فَلَمَّا كُتِبَ عَلَيْهِمُ الْقِتَالُ) – o zaman ki cihad etmək onlara yazılıb vacib oldu, (تَوَلَّوْا اِلَّا قَلِيلًا مِنْهُمْ) - savaşdan qaçdılar, ancaq az olan şəxslər savaşda möhkəm dayandılar. (وَاللّٰهُ عَلِيمٌ بِالظَّالِمِينَ) - Allah-Təala cihadı tərk edən zalımlardan agahdır. Zülmlərinin cəzasını onlara verəcəkdir. Savaşın xüsusiyyəti sıradakı ayədə qeyd olunur. Bəni-İsrailin əksəriyyəti savaşdan qaçdı, ancaq 313 nəfər qaldı).**

**247) (وَقَالَ لَهُمْ نَبِيُّهُمْ) - bəni-İsrail camaatına onların peyğəmbəri İşmoil** (Samuel) **dedi: (اِنَّ اللّٰهَ قَدْ بَعَثَ لَكُمْ طَالُوتَ مَلِكًا) - həqiqətən, Allah-Təala sizdən ötrü Talutu* padşah təyin edibdir.**

*(*__Qeyd:__ Tövratda yəhudi dilində Talutun adı Sauldur, ərəb dilində Talut deyilir).*

**(قَالُوٓا اَنّٰى يَكُونُ لَهُ الْمُلْكُ عَلَيْنَا) - bəni-İsrail dedi: o necə bizə padşah ola bilər? Talut necə bizə padşahlıq edər? (وَنَحْنُ اَحَقُّ بِالْمُلْكِ مِنْهُ) - halbuki mal və dövlət sahibi olduğumuzdan padşahlığa biz daha layiqik. Biz varlı, Talut isə yoxsuldur. Yoxsul biri varlılara necə padşah ola bilər? (وَلَمْ يُؤْتَ سَعَةً مِنَ الْمَالِ) – və Taluta mal cəhətdən də genişlik** (bolluq) **verilməyibdir. (قَالَ اِنَّ اللّٰهَ اصْطَفٰيهُ عَلَيْكُمْ) - peyğəmbər** (İşmoil-Samuel) **dedi: həqiqətən, Allah-Təala Talutu sizin üçün seçib padşah təyin edibdir. (Allah-Təalanın hökmünə etiraz etmək olmaz, bundan başqa, onda iki xüsusiyyət də vardır. O xüsusiyyətlərə görə, səltənətə layiqdir. O iki xüsusiyyət budur: (وَزَادَهُ بَسْطَةً فِي الْعِلْمِ وَالْجِسْمِ) - Allah-Təala Taluta həm elmdə, həm də bədən olaraq üstünlük veribdir. (Yəni həm savaşda, həm də elmdə kamildir, həm də qüvvətlidir). (وَاللّٰهُ يُؤْتِي مُلْكَهُ مَنْ يَشَآءُ) - Allah-Təala mülkünü istədiyinə verər. (وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ) - Allah-Təala bəxşiş verməkdə genişlik** (bolluq) **sahibidir. Padşahlıqdan ötrü kimi seçəcəyini də bilir.**

**248) (وَقَالَ لَهُمْ نَبِيُّهُمْ) - peyğəmbərləri İşmoil** (Samuel) **bəni-İsrailə dedi: "Bu Talutun sizə padşah olmağının bir əlaməti* vardır. Əgər o əlamət vaqe olsa, bilin ki, o, Allah-Təala tərəfindən sizə padşahdır".**

اِنَّ اٰيَةَ مُلْكِهٖٓ اَنْ يَاْتِيَكُمُ التَّابُوتُ فِيهِ سَكِينَةٌ مِنْ رَبِّكُمْ وَبَقِيَّةٌ مِمَّا تَرَكَ اٰلُ مُوسٰى وَاٰلُ هٰرُونَ تَحْمِلُهُ الْمَلٰٓئِكَةُۜ اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لَكُمْ اِنْ كُنْتُمْ مُؤْمِنِينَ۟﴿٢٤٨﴾ فَلَمَّا فَصَلَ طَالُوتُ بِالْجُنُودِۙ قَالَ

---

*(*Qeyd: O əlamət bu idi ki, Hz. Musa şümşad ağacından bir sandıq düzəltmişdi. O sandığın üzünü qızılla bəzəyib, Allah-Təala tərəfindən nazil olmuş Tövratı onun içində saxlayardı. Onun adına "tabutu-Səkinə" deyilirdi. Bəni-İsrail nə vaxt savaşa getsəydi, o tabutu ordunun qabağında aparardı və bu səbəbdən hər bir savaşda düşmənə qalib gələrdi. Bəni-İsrail tüğyan edib Allaha itaətdən çıxandan sonra Calut (Qolyat) onlara hakim olub tabutu onlardan alıb, aparıb öz məmləkətində saxladı. Elə ki bəni-İsrail qərar verdi ki, Calutla savaşıb, "tabutu-Səkinə"ni ondan alsın, özləri üçün padşah seçmək istədilər. İşmoil (Samuel) peyğəmbər Allah-Təalanın əmri ilə Talutu onlara padşah təyin etdi. Bəni-İsrail razı olmadı. İşmoil dedi: "Onun padşahlığının əlaməti budur ki, bu günlərdə "tabutu-Səkinə" sizin əlinizə keçər". O biri tərəfdən Calutun qövmü xəstəliyə düçar olub, məhv olurdular. Dedilər: "Bu bəla bizə bu tabutun səbəbinə varid oldu, gərək biz tabutu aramızdan götürək". O tabutu götürüb iki öküzün üstünə bağlayıb, bəni-İsrail tərəfinə buraxdılar. Tabutu daşıyan o öküzlər bəni-İsrailin yurduna gəldilər. Necə ki Allah-Təala burada İşmoildən nəql edir).*

**(اِنَّ اٰيَةَ مُلْكِهٖٓ) - həqiqətən, Talutun səltənətə sahib olmasının əlaməti budur ki, (اَنْ يَاْتِيَكُمُ التَّابُوتُ) - Tövratdan ötrü düzəldilmiş "tabutu-Səkinə" sizə gələr. (فِيهِ سَكِينَةٌ مِنْ رَبِّكُمْ) - o sandıqda rəbbiniz Allah-Təala tərəfindən vüqar və təmkin, qəlbinizin aram olmağı vardır.** (Elə ki o sandıq savaş zamanı bəni-İsrailin qabağında olurdu, qəlbləri aram olub sakit olurdular)**. (وَبَقِيَّةٌ مِمَّا تَرَكَ اٰلُ مُوسٰى وَاٰلُ هٰرُونَ) - Musanın, Harundan sonra Yaqubun nəslindən gələn peyğəmbərlərin o sandıqda qoyduqları bəzi şeylər vardır.** (Sandıqda olan şeylər bunlar idi: Musanın əsası və libası, Tövratın natamam bir hissəsi). **(تَحْمِلُهُ الْمَلٰٓئِكَةُ) - mələklər o tabutu daşıyıb, sizin tərəfinizə gətirdilər.** (Yəni o öküzlər ki, sandığı onlara bağlamışdılar, mələklər* onları sürüb bəni-İsrailə gətirdilər). **(اِنَّ فِي ذٰلِكَ لَاٰيَةً لَكُمْ) - həqiqətən, bu "tabutu-Səkinə" sizə gəlməklə gərək Talutun səltənətinə razı olasınız. (اِنْ كُنْتُمْ مُؤْمِنِينَ) - əgər Allah-Təalaya iman gətirənsizsə, gərək, Talutun səltənətini qəbul edəsiniz.** ("Tabutu-Səkinə" gələndən sonra Bəni-İsrail Talutun padşahlığına razı oldu. Talut qoşunu toplayıb belə hökm verdi: "Bina tikməklə, ticarətlə məşğul olan, evlənən, övlad sahibi olan kişilərdən bir nəfər mənimlə bu savaşa gəlməsin. Bu savaşda mənə ancaq qüvvətli, evli olmayan cavanlar lazımdır". Belə cavanlardan 80 min nəfər toplandı. Qoşunun tədarükünü görüb yola düşdülər. Necə ki sıradakı ayədə buyurur).

*(*Qeyd: Hər bir şər olan əməl şeytana isnad edilən kimi hər bir xeyir olan əməl də mələklərə isnad edilir).*

**249) (فَلَمَّا فَصَلَ طَالُوتُ بِالْجُنُودِ) – o zaman ki Talut öz yerindən əsgərlərlə aralanıb düşmənə tərəf getməyə başladı, (قَالَ) - Talut öz qoşununa belə**

اِنَّ اللّٰهَ مُبْتَلٖيكُمْ بِنَهَرٍۚ فَمَنْ شَرِبَ مِنْهُ فَلَيْسَ مِنّٖيۚ وَمَنْ لَمْ يَطْعَمْهُ فَاِنَّهُ مِنّٖٓي اِلَّا مَنِ اغْتَرَفَ غُرْفَةً
بِيَدِهٖۚ فَشَرِبُوا مِنْهُ اِلَّا قَلٖيلًا مِنْهُمْ فَلَمَّا جَاوَزَهُ هُوَ وَالَّذٖينَ اٰمَنُوا مَعَهُۙ قَالُوا لَا طَاقَةَ لَنَا الْيَوْمَ بِجَالُوتَ
وَجُنُودِهٖۜ قَالَ الَّذٖينَ يَظُنُّونَ اَنَّهُمْ مُلَاقُوا اللّٰهِۙ كَمْ مِنْ فِئَةٍ قَلٖيلَةٍ غَلَبَتْ فِئَةً كَثٖيرَةً بِاِذْنِ اللّٰهِۜ وَاللّٰهُ مَعَ
الصَّابِرٖينَ ﴿٢٤٩﴾ وَلَمَّا بَرَزُوا لِجَالُوتَ وَجُنُودِهٖ قَالُوا رَبَّنَٓا اَفْرِغْ عَلَيْنَا صَبْرًا وَثَبِّتْ اَقْدَامَنَا وَانْصُرْنَا
عَلَى الْقَوْمِ الْكَافِرٖينَۜ ﴿٢٥٠﴾

---

**dedi: (ey camaat, mənim sözlərimə gərək itaət edib əmrimdən çıxmayasınız. Sizi imtahan edəcəyəm. Görüm, itaətkarsınız, yoxsa yox. (اِنَّ اللّٰهَ مُبْتَلٖيكُمْ) (بِنَهَرٍ) - imtahan budur ki, Allah-Təala sizi bir çayla imtahan edəcək,** (indi o çaya düçar olacaqsınız.) **(فَمَنْ شَرِبَ مِنْهُ) - o çayın suyundan kim içsə, (فَلَيْسَ مِنّٖي) - o şəxs məndən deyil, məndən kənar olub mənim qoşunumda olmasın. (وَمَنْ لَمْ يَطْعَمْهُ فَاِنَّهُ مِنّٖٓي) - kim o sudan dadmasa, həqiqətən, o şəxs məndəndir, mənim qoşunumda olacaqdır. (اِلَّا مَنِ اغْتَرَفَ غُرْفَةً بِيَدِهٖ) - belə deyil ki, su içməklə o çayın suyu qurtarar. Əksinə, o çaydan bir ovucdan artıq su içmək, ya da götürmək, haramdır. (فَشَرِبُوا مِنْهُ اِلَّا قَلٖيلًا مِنْهُمْ) - qoşun əhli Taluta itaət etməyib o çayın suyundan bir ovucdan artıq içdi. Ancaq onların az bir qismi bir ovuc suya qənaət etdilər.** (Bir ovuc suya qənaət edən 313 nəfər sudan doydu. Başqalarının üzləri və ağızları qaralıb, daha da susadılar. Talut 313 nəfərlə savaşa gedib, qalanları çayın kənarında qaldı). **(فَلَمَّا جَاوَزَهُ هُوَ وَالَّذٖينَ اٰمَنُوا مَعَهُ) – o zaman ki Talut və onunla birlikdə Allah-Təalaya iman gətirib imtahan vaxtı səbir edənlər həmin çaydan keçdilər, (قَالُوا) - keçəndən sonra düşmən qoşununun çoxluğunu görən o 313 nəfər dedi: (لَا طَاقَةَ لَنَا الْيَوْمَ بِجَالُوتَ وَجُنُودِهٖ) - "Bugünkü gündə Calut** (Qolyat) **və onun qoşunu ilə üzbəüz durub savaşmağa bizdə güc və taqət olmayacaqdır". (قَالَ الَّذٖينَ يَظُنُّونَ اَنَّهُمْ مُلَاقُوا اللّٰهِ) – o 313 nəfərdən qiyamət günündə Allah-Təalanın rəhməti ilə qarşılaşacaqlarına inananlar dedilər: (كَمْ مِنْ فِئَةٍ قَلٖيلَةٍ) - "Çox olubdur ki, az camaat, (غَلَبَتْ فِئَةً كَثٖيرَةً بِاِذْنِ اللّٰهِ) - Allah-Təalanın izni ilə çox olan camaata qalib olub. Cihad etməkdə səbir edin. (وَاللّٰهُ مَعَ الصَّابِرٖينَ) - Allah-Təala səbir edənlərlə birlikdədir və onlara köməkdir".**

**250) (وَلَمَّا بَرَزُوا لِجَالُوتَ وَجُنُودِهٖ) – o zaman ki bəni-İsrail Calutun** (Qolyat) **özü və qoşunu üçün aşkar olub göründülər, başladılar savaşmağa, (قَالُوا رَبَّنَٓا) (اَفْرِغْ عَلَيْنَا صَبْرًا) - dedilər: "Ey bizim rəbbimiz, qəlbimizi səbir ilə doldur. (وَثَبِّتْ اَقْدَامَنَا) - bizim qəlbimizi savaşda sabit və möhkəm et. (وَانْصُرْنَا عَلَى الْقَوْمِ الْكَافِرٖينَ) - bizə kömək olub, bizi bu kafir olan qövm və camaata qalib et".** (Bu duanı edib savaşa başladılar). Davud peyğəmbərin atası İşu (İşay, Yessey) bu davada 7 nəfər oğlu ilə hazır idi. Yaşda hamısından kiçik Davud idi. Çöldə qoyun otarırdı. Bu savaşı eşidib qoyunlarını çöldə qoyub savaşa gəldi. Yol əsnasında 3 ədəd daş götürüb kisəsinin içinə qoydu. Elə ki savaş qızışdı, Davud Calutla

فَهَزَمُوهُمْ بِإِذْنِ اللّٰهِ وَقَتَلَ دَاوُدُ جَالُوتَ وَاٰتٰيهُ اللّٰهُ الْمُلْكَ وَالْحِكْمَةَ وَعَلَّمَهُ مِمَّا يَشَآءُ وَلَوْلَا دَفْعُ اللّٰهِ النَّاسَ بَعْضَهُمْ بِبَعْضٍ لَفَسَدَتِ الْاَرْضُ وَلٰكِنَّ اللّٰهَ ذُو فَضْلٍ عَلَى الْعَالَمِينَ ﴿٢٥١﴾ تِلْكَ اٰيَاتُ اللّٰهِ نَتْلُوهَا عَلَيْكَ بِالْحَقِّ وَاِنَّكَ لَمِنَ الْمُرْسَلِينَ ﴿٢٥٢﴾ تِلْكَ الرُّسُلُ فَضَّلْنَا بَعْضَهُمْ عَلٰى بَعْضٍ مِنْهُمْ مَنْ كَلَّمَ اللّٰهُ وَرَفَعَ بَعْضَهُمْ دَرَجَاتٍ وَاٰتَيْنَا عِيسَى ابْنَ مَرْيَمَ الْبَيِّنَاتِ وَاَيَّدْنَاهُ بِرُوحِ الْقُدُسِ وَلَوْ شَآءَ اللّٰهُ مَا اقْتَتَلَ الَّذِينَ مِنْ بَعْدِهِمْ مِنْ بَعْدِ مَا جَآءَتْهُمُ الْبَيِّنَاتُ

---

(Qolyat) qarşılaşdı. O üç daşın birini sapanda qoyub Calutun başından vurdu, elə o anda Calut atından yıxılıb həlak oldu. Qoşunu tamamən dağılıb əşyaları bəni-İsrailə qənimət oldu. Necə ki sıradakı ayədə xəbər verir).

**251) (فَهَزَمُوهُمْ بِإِذْنِ اللّٰهِ) - bəni-İsrail Calutun** (Qolyat) **qoşununu Allah-Təalanın izni ilə dağıtdı. (وَقَتَلَ دَاوُدُ جَالُوتَ) – və Davud Calutu öldürdü. (وَاٰتٰيهُ اللّٰهُ الْمُلْكَ وَالْحِكْمَةَ) - Allah-Təala Davuda həm padşahlıq, həm də peyğəmbərlik verdi. (وَعَلَّمَهُ مِمَّا يَشَآءُ) – və ona istədiyi hər işi öyrətdi. (وَلَوْلَا دَفْعُ اللّٰهِ النَّاسَ بَعْضَهُمْ بِبَعْضٍ لَفَسَدَتِ الْاَرْضُ) - əgər Allah-Təala şərir insanların fəsadını şərir olmayanların vasitəsilə yer üzündən dəf etməsə idi, yer üzü fitnə-fəsad içində olub mənfəətləri batil olardı.** (Çünki fəsad olan vaxt yerdən heç bir mənfəət əldə etmək olmaz). **(وَلٰكِنَّ اللّٰهَ ذُو فَضْلٍ عَلَى الْعَالَمِينَ) - lakin Allah-Təala bütün aləmlərə lütf və ehsan sahibi olduğundan yer üzündən fəsadı dəf edir, xalq yerdən mənfəət əldə etsin.**

**252) (تِلْكَ اٰيَاتُ اللّٰهِ نَتْلُوهَا عَلَيْكَ بِالْحَقِّ وَاِنَّكَ لَمِنَ الْمُرْسَلِينَ)** – (ey Məhəmməd), **bu qeyd olunanlar Allah-Təalanın ayələridir. Haqq ilə sənə oxuyuruq, əlbəttə sən Allah-Təala tərəfindən göndərilmiş peyğəmbərlərdənsən.** (Ey Məhəmməd, bu xəbərləri fəsih ifadələrlə xalqa çatdırmaq onu oxumadığın halda, sənin haqq olmağına möhkəm olan dəlil deyilmi?)

**253) (تِلْكَ الرُّسُلُ)** – (ey Məhəmməd), **bu peyğəmbərlər ki, onların qissələri sənin üçün qeyd olunur, (فَضَّلْنَا بَعْضَهُمْ عَلٰى بَعْضٍ) - o peyğəmbərlərin bəzisinin dərəcəsini digər bəzilərinə üstün etmişik. (مِنْهُمْ مَنْ كَلَّمَ اللّٰهُ) - o peyğəmbərlərdən bəzisi var ki, Allah-Təala onunla** (Hz. Musa ilə) **vasitəsiz danışıbdır. (وَرَفَعَ بَعْضَهُمْ دَرَجَاتٍ) - bəzilərinin** (Hz. İbrahimin, bir də onun nəslindən - bizim uca peyğəmbərimiz olan Hz. Məhəmmədin ə.s) **dərəcəsini digər peyğəmbərlərdən uca edibdir. (Allah-Təala peyğəmbərimizi digər peyğəmbərlərdən uca edib, Qurani-Şərif kimi bir kitabı ona bəxş edibdir, heç bir peyğəmbərə belə kitab verməyibdir). (وَاٰتَيْنَا عِيسَى ابْنَ مَرْيَمَ الْبَيِّنَاتِ) - İsa Məryəm oğluna aşkar olan möcüzələr verdik. (وَاَيَّدْنَاهُ بِرُوحِ الْقُدُسِ) - pak və müqəddəs olan Ruhla onu qüvvətləndirdik. (وَلَوْ شَآءَ اللّٰهُ مَا اقْتَتَلَ الَّذِينَ مِنْ بَعْدِهِمْ) - əgər Allah-Təala istəsəydi, peyğəmbərlərdən sonra gələn insanların bir-biriylə savaşmalarına zorla mane olardı, (مِنْ بَعْدِ مَا جَآءَتْهُمُ الْبَيِّنَاتُ)**

وَلٰكِنِ اخْتَلَفُوا فَمِنْهُمْ مَنْ اٰمَنَ وَمِنْهُمْ مَنْ كَفَرَ ۜ وَلَوْ شَٓاءَ اللّٰهُ مَا اقْتَتَلُوا وَلٰكِنَّ اللّٰهَ يَفْعَلُ مَا يُرِيدُ
﴿٢٥٣﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اَنْفِقُوا مِمَّا رَزَقْنَاكُمْ مِنْ قَبْلِ اَنْ يَاْتِيَ يَوْمٌ لَا بَيْعٌ فِيهِ وَلَا خُلَّةٌ وَلَا شَفَاعَةٌ
ۜ وَالْكَافِرُونَ هُمُ الظَّالِمُونَ ﴿٢٥٤﴾

---

**- peyğəmbərlərin vasitəsilə aşkar olan dəlillər onlara gələndən sonra.** (Bununla belə yenə ixtilaf etdilər, halbuki, gərək, heç bir ixtilaf etməyib, o dəlillərə tabe olub peyğəmbərlərə iman gətirəydilər). **(وَلٰكِنِ اخْتَلَفُوا) - lakin bu aşkar dəlillərə baxmayaraq, yenə ixtilaf edib savaşdılar. (Allah-Təala insanı hər bir əməlində azad iradə sahibi etdiyindən onların bir-biri ilə savaşmalarına mane olmadı). (فَمِنْهُمْ مَنْ اٰمَنَ وَمِنْهُمْ مَنْ كَفَرَ) – insanlardan bəzisi Allah-Təalaya iman gətirdi. Bəzisi kafir olub bir-biriləri ilə savaşdılar. (وَلَوْ شَٓاءَ اللّٰهُ مَا اقْتَتَلُوا) - əgər Allah-Təala istəsəydi, insanlar bir-biriləri ilə savaşmazdılar.** (İnsan öz əməllərində azad olduğundan yenidən bu ayəni təkidlə təkrar edir)**. (وَلٰكِنَّ اللّٰهَ يَفْعَلُ مَا يُرِيدُ) - lakin Allah-Təala istədiyini edər. İnsanların bir-biri ilə savaşması Allah-Təalanın istəyini dəyişdirməz.**

**254) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا) - ey iman gətirənlər, (اَنْفِقُوا مِمَّا رَزَقْنَاكُمْ) - o şeylərdən ki, sizə ruzi vermişik, din və millətə kömək edib, ehsan edib xərcləyin, (مِنْ قَبْلِ اَنْ يَاْتِيَ يَوْمٌ) - bu ehsanı edin sizə o gün** (qiyamət) **gəlmədən. (لَا بَيْعٌ فِيهِ) - o gündə alış-veriş olmaz ki, ehsan edib xərcləməyə qadir olasınız. (وَلَا خُلَّةٌ) - nə də dostluq olmaz dostluq səbəbi ilə sizə diqqət etsinlər, (وَلَا شَفَاعَةٌ) - nə də heç kim sizdən ötrü şəfaət edə bilməz. Ta ki sizə əzab olunmasın. (وَالْكَافِرُونَ هُمُ الظَّالِمُونَ) - Allah-Təalanın hökmlərinə itaət etməyib, kafir olub din və ümmət yolunda ehsanı tərk edənlər kafir olmaqla birlikdə həm də zalımdırlar. Ola bilər ki, şəxs kafir olub amma zalım olmasın. Asiliyin ən yüksək dərəcəsi kafirliklə birlikdə, həm də zalım olmaqdır. Bu ayə göstərir ki, din və ümmət yolunda ehsanı tərk edən varlı şəxslər zalım sayılıb kafir hökmündədirlər. Xüsusən, ehsanı** (zəkatı) **tərk edənlər). (Gələn ayəyə "ayətül-kürsi" deyilir, Hz. Peyğəmbərdən bu ayənin fəziləti haqqında bir neçə hədis varid olubdur. Onlardan ikisini nümunə üçün burada nəql edək: 1. Hz. Peyğəmbər (ə.s), buyurdu: "Ey Əli, övladına, ailənə və qonşularına "Ayətul-kürsi"ni öyrət. Çünki heç bir ayə nazil olmayıbdır ki, bu ayədən* əzəmətli olsun";** (Əhməd b. Hənbəl, Müsnəd, V/142-178) **2. Bir gün səhabələr Quranın surə və ayələrindən hansının daha fəzilətli olması haqqında danışırdılar. Hz. Əli buyurdu: "Kəlamların ağası Qurandır, Quranın ağası Bəqərə surəsidir, Bəqərənin ağası "ayətul-kürsi"dir".**

*(****Qeyd:*** *Sual: nəyə görə bu ayə Quranın digər ayələrindən fəzilətli sayılır? Cavab: bu mübarək ayənin Allahın kamal sifətləri haqqında ehtiva etdiyi mənaları düşünsən, o vaxt səndən ötrü onun fəziləti aydın olar).*

اَللّٰهُ لَآ اِلٰهَ اِلَّا هُوَۚ اَلْحَيُّ الْقَيُّومُۚ لَا تَاْخُذُهُ سِنَةٌ وَلَا نَوْمٌۜ لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ مَنْ ذَا الَّذِي يَشْفَعُ عِنْدَهُ اِلَّا بِاِذْنِهِۜ يَعْلَمُ مَا بَيْنَ اَيْدِيهِمْ وَمَا خَلْفَهُمْۚ وَلَا يُحِيطُونَ بِشَيْءٍ مِنْ عِلْمِهٖٓ اِلَّا بِمَا شَٓاءَۚ وَسِعَ كُرْسِيُّهُ السَّمٰوَاتِ وَالْاَرْضَۚ وَلَا يَؤُدُهُ حِفْظُهُمَاۚ وَهُوَ الْعَلِيُّ الْعَظِيمُ ﴿٢٥٥﴾

---

**255) (اَللّٰهُ لَآ اِلٰهَ اِلَّا هُوَ اَلْحَيُّ الْقَيُّومُ) - haqq olan məbud Allah-Təaladır. Ondan başqa, haqq olan məbud yoxdur. Ondan başqa, bütün məbudlar batildir. Həmişə diri və əbədidir. Pak Zatına yoxluq yol tapa bilməz. Müqəddəs pak Zatı ilə xalqın işlərinin tədbirinə və onları mühafizə etməyə həmişə qadirdir. (لَا تَاْخُذُهُ سِنَةٌ وَلَا نَوْمٌ) - Allah-Təalanın pak Zatını nə mürgü, nə də yuxu tutmaz. Çünki yuxu gələn vaxt şəxs süstləşər və yatan şəxs hər bir şeydən qafil olar. Bütün varlıqların həqiqi idarə edəni heç bir zaman öz işindən qafil olmadığı üçün onun müqəddəs Zatını mürgü və yuxu tutmaz. (لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) - səmalarda və yerdə olan hər bir şey Allah-Təalanın mülküdür və onun səltənətinə tabedir. Bir zərrə də onun hakimiyyətindən kənara çıxa bilməz. (مَنْ ذَا الَّذِي يَشْفَعُ عِنْدَهُ اِلَّا بِاِذْنِهِ) - kimdir o şəxs ki, günahkarlardan ötrü şəfaət etsin? Ancaq Allah-Təalanın izni ilə şəfaət edə bilər.***

*(***Qeyd:** Bu ayə peyğəmbər və imamları, hətta digər övliyaları da müstəqil şəfaətçi sayır, onları hətta qiyamət günündə cənnət və cəhənnəmin ixtiyar sahibi zənn edənlərin gözlərinə və qəlblərinə Allah-Təala tərəfindən parlaq bir ulduz kimi çaxır. Qiyamət günündə heç bir şəxsin danışmağa və şəfaətə qüdrəti olmaz. Ancaq Allah-Təalanın izni ilə olar. O gün səltənət və böyüklük, şan və cəlal Allah-Təalaya məxsusdur. O gün Allah-Təalanın xüsusi rəhməti bizə şamil olsun. Amin!)*

**(يَعْلَمُ مَا بَيْنَ اَيْدِيهِمْ وَمَا خَلْفَهُمْ) - Allah-Təala məxluqatdan qabaq və sonra səmalarda və yerdə olan hər bir şeyə agahdır. (وَلَا يُحِيطُونَ بِشَيْءٍ مِنْ عِلْمِهٖٓ اِلَّا بِمَا شَٓاءَ) - Allah-Təala istəmədikcə Onun elmindən heç bir şeyə agah olmazlar, ancaq Allah-Təala özü onu istəsə, öyrədər. (وَسِعَ كُرْسِيُّهُ السَّمٰوَاتِ وَالْاَرْضَ) - Allah-Təalanın elm və qüdrəti səmaları və yeri əhatə edib, heç bir şey Allah-Təalanın elm və qüdrətindən kənar ola bilməz,** ("kürsü" sözünü qeyd etməkdə məqsəd aləmlərin yaradıcısının əzəmətini təsəvvür etməkdən ötrüdür. Allahın əzəməti bir növ padşahın qüdrətinə bənzədilir, necə ki padşah taxt üstündə oturub, rəiyyətinə hökm edir, Allahın hökmü də belə olub, Onun tabe olunması vacib olan fərmanından kənara çıxmaq imkansızdır). **(وَلَا يَؤُدُهُ حِفْظُهُمَا) - səmaları və yeri qorumaq Allah-Təala üçün ağır və məşəqqətli olan bir iş deyildir. (وَهُوَ الْعَلِيُّ الْعَظِيمُ) - şanı uca, qüdrət və səltənəti böyük olan Allah-Təaladır.**

لَا اِكْرَاهَ فِي الدّ۪ينِ قَدْ تَبَيَّنَ الرُّشْدُ مِنَ الْغَيِّ فَمَنْ يَكْفُرْ بِالطَّاغُوتِ وَيُؤْمِنْ بِاللّٰهِ فَقَدِ اسْتَمْسَكَ بِالْعُرْوَةِ الْوُثْقٰى لَا انْفِصَامَ لَهَا وَاللّٰهُ سَم۪يعٌ عَل۪يمٌ ﴿٢٥٦﴾ اَللّٰهُ وَلِيُّ الَّذ۪ينَ اٰمَنُوا يُخْرِجُهُمْ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ وَالَّذ۪ينَ كَفَرُٓوا اَوْلِيَٓاؤُ۬هُمُ الطَّاغُوتُ يُخْرِجُونَهُمْ مِنَ النُّورِ اِلَى الظُّلُمَاتِ

---

**256) (لَا اِكْرَاهَ فِي الدّ۪ينِ) - islama daxil olmaqda məcburiyyət və zülm yoxdur. Əksinə islama daxil olmağın əsası sərbəst iradədir. (قَدْ تَبَيَّنَ الرُّشْدُ مِنَ الْغَيِّ)* - həqiqətən, islam dini küfr və şirkdən Qurani-Şərifin səbəbinə təmizlənib aralanıbdır. Daha islama daxil olmaqda məcburiyyət lazım deyildir. Nə zaman ki bir şeyin haqq olduğuna bir dəlil oldu, o vaxt məcbur etməyin mənası yoxdur. (فَمَنْ يَكْفُرْ بِالطَّاغُوتِ) - kim ki bütləri inkar edib, (وَيُؤْمِنْ بِاللّٰهِ) - Allah-Təalaya iman gətirsə, (فَقَدِ اسْتَمْسَكَ بِالْعُرْوَةِ الْوُثْقٰى) - həqiqətən, o şəxs möhkəm olan ipdən** (qulpdan) **yapışıbdır. (لَا انْفِصَامَ لَهَا) – onun üçün qopmaq və qırılmaq yoxdur. (وَاللّٰهُ سَم۪يعٌ عَل۪يمٌ) - Allah-Təala insanların sözlərini eşidən və onların əməllərinə agah olandır.**

*(*****Qeyd:*** *O şəxslər ki islama irad tutub deyir: "Hz. Peyğəmbər xalqı zorla, qılınc gücü ilə islama daxil etdi, bu ayə onların sözlərini rədd edir. O həzrətə belə bir şeyi isnad etmək böyük xətadır. Bəli, bu həzrətin savaşlarını inkar etmək olmaz, ancaq o savaşlar müdafiə məqsədi ilə olub, düşmən ona hücum edib, o da məcbur və naəlac müdafiə məqsədi ilə savaşıbdır. Əgər o, həqiqətən, zorla xalqı islama daxil etsəydi, gərək islamda cizyə olmayaydı, halbuki əhli-zimmənin (əhli-kitab) cizyə verməsi islamın böyük ehkamındandır. Müsəlmanlar əhli-kitaba (yəhudi və xristiana) qalib gəlib onları özlərinə tabe edəndən sonra əgər öz ixtiyarları ilə islama daxil olsalar, o vaxt onlar üçün islamın müsəlmanlara aid olan hökmü məcburidir. Əgər daxil olmasalar, bir miqdar cizyə və xərac verib, öz dinlərində qalarlar. İslamda müsəlman şəxsə olduğu kimi, cizyə verən əhli-zimməyə də kömək etmək dinin vacib hökmlərindən hesab olunur. Əgər cizyə verən əhli-zimmədən bir nəfəri qətlə yetirsələr, qatil müsəlman da olsa, o qatildən qisas almaq lazımdır. Belə olan halda, islamda olmayan şeyi ona isnad etmək böyük bir insafsızlıqdır. Amma cizyə almağı heç kim eyib saya bilməz. Bu, həmin cizyədir ki, bütün dünyada padşahlar alırlar, o həzrət və onun xəlifələri də ədalət üzrə alırdılar. Hz. Peyğəmbər 13 il Məkkədə yaşayıb, orada savaşdı, bir nəfərə ağır bir söz dedimi? İnsanlar öz arzuları ilə gəlib islama daxil olurdular. Mədinəyə hicrət edəndən sonra Məkkə əhli toplanıb o həzrətlə savaşmaq üçün Mədinəyə gəldi. O zaman savaşmamalı idi? Ağıllı olan şəxs qollarını bağlayıb özünü düşmənə təslim edərmi?)*

**257) (اَللّٰهُ وَلِيُّ الَّذ۪ينَ اٰمَنُوا) - iman gətirənlərin bütün işlərinin hakimi Allah-Təaladır.** (Yəni möminlər bütün işlərini və özlərinin ixtiyarını Allah-Təalaya həvalə edirlər). **(يُخْرِجُهُمْ مِنَ الظُّلُمَاتِ اِلَى النُّورِ) - Allah-Təala möminləri qaranlıqlardan işığa çıxarar.** (O işıq onları dünya və axirətdə böyük nemətlərə qovuşdurar). **(وَالَّذ۪ينَ كَفَرُٓوا) - o şəxslər ki Allah-Təalanı inkar edib, (اَوْلِيَٓاؤُ۬هُمُ الطَّاغُوتُ) - onların dostları bütlərdir. (يُخْرِجُونَهُمْ مِنَ النُّورِ اِلَى الظُّلُمَاتِ) - o bütlər kafirləri**

اُولٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فِيهَا خَالِدُونَ ﴿٢٥٧﴾ اَلَمْ تَرَ اِلَى الَّذِي حَآجَّ اِبْرٰهِيمَ فِي رَبِّهٖٓ
اَنْ اٰتٰيهُ اللّٰهُ الْمُلْكَۢ اِذْ قَالَ اِبْرٰهِيمُ رَبِّيَ الَّذِي يُحْيِي وَيُمِيتُۙ قَالَ اَنَا اُحْيِي وَاُمِيتُۜ قَالَ
اِبْرٰهِيمُ فَاِنَّ اللّٰهَ يَاْتِي بِالشَّمْسِ مِنَ الْمَشْرِقِ فَاْتِ بِهَا مِنَ الْمَغْرِبِ فَبُهِتَ الَّذِي كَفَرَۜ وَاللّٰهُ
لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَۚ ﴿٢٥٨﴾ اَوْ كَالَّذِي مَرَّ عَلٰى قَرْيَةٍ

---

**nurdan zülmətə çıxarar. Heç vaxt onlardan ötrü işıq olmaz. (اُولٰٓئِكَ اَصْحَابُ النَّارِ) - onlar cəhənnəm əhli və od yoldaşlarıdır. (هُمْ فِيهَا خَالِدُونَ) - əlbəttə, onlar cəhənnəm odunda həmişəlik qalarlar.**

**258) (اَلَمْ تَرَ) –** (ey Məhəmməd)**, bəs baxmırsan?** (Əlbəttə, bizim xəbər verdiyimizə baxıb təfəkkür et,) **(اِلَى الَّذِي حَآجَّ اِبْرٰهِيمَ فِي رَبِّهٖٓ) - o şəxsin** (yəni Nəmrud, o, Hz. İbrahimin zamanında Babildə padşah idi) **əhvalına ki, İbrahim ilə onun rəbbi Allah-Təala haqqında mübahisə edib Allah-Təalanı inkar edib dedi: “Mən özüm Allaham”. (اَنْ اٰتٰيهُ اللّٰهُ الْمُلْكَ) -** (Nəmrud Hz. İbrahim ilə mübahisə etdi, Allah-Təala ona padşahlıq vermişdi, halbuki gərək, Allah-Təalaya şükür edə idi. Amma şükrün əvəzində inad edib Allah-Təalanı inkar edib) **Hz. İbrahim ilə Allah-Təala haqqında mübahisə və münaqişə etdi. (اِذْ قَالَ اِبْرٰهِيمُ) –İbrahim mübahisə vaxtı Nəmruda deyəndə ki, sən Allah-Təalanı inkar edirsən? (رَبِّيَ الَّذِي يُحْيِي وَيُمِيتُ) - Mənim rəbbim o Allah-Təaladır ki, məxluqata həyat verən və öldürəndir. Sənin də buna qüdrətin var? (قَالَ اَنَا اُحْيِي وَاُمِيتُ) -** (Nəmrud) **dedi: “Mən də dirildib öldürürəm”.** (Əmr etdi, iki nəfər müqəssiri gətirdilər, birini bağışlayıb buraxdı, o birisini qətlə yetirdi. Dedi: “Ey İbrahim, budur, mən də öldürüb diriltməyə qadirəm”. Hz. İbrahim baxıb gördü, Nəmrud axmaqlıq və ağılsızlıqdan onun dəlilini ancaq öldürüb diriltməyə isnad etdi. İbrahim o dəlildən vaz keçib, ondan daha aydın dəlil gətirdi). **(قَالَ اِبْرٰهِيمُ) - Hz. İbrahim dedi: (فَاِنَّ اللّٰهَ يَاْتِي بِالشَّمْسِ مِنَ الْمَشْرِقِ) - “Həqiqətən, Allah-Təala günəşi məşriqdən gətirir”. (فَاْتِ بِهَا مِنَ الْمَغْرِبِ) - əgər sənin qüdrətin varsa, günəşi məğribdən gətir (ki, sənin də Allah olmağın məlum olsun”.) (فَبُهِتَ الَّذِي كَفَرَ) - bəs kafir olan Nəmrud onun cavabında aciz və çaşqın qaldı. (وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ) - Allah-Təala zalım qövmü və camaatı haqq tərəfinə hidayət etməz. Əksinə, küfrlərində qalıb həlak olarlar.** (Bəni-İsraildən bir peyğəmbər bir ulağa minib gedirdi, yemək üçün ənciri, üzümü və içmək üçün südü var idi. Elə bir qəsəbəyə yetişdi ki, ora tamam xarab olub əhalisi də tamamən həlak olmuşdu. Fikirləşib təəccüblə dedi: “Görəsən Allah-Təala bunları necə dirildəcəkdir”? Həmin anda Allah-Təala onun ruhunu alıb, 100 il o halda saxladı, 100 ildən sonra da onu diriltdi. Necə ki Allah-Təala növbəti ayədə xəbər verir).

**259) (اَوْ كَالَّذِي) – ya da görübsən,** (ey Məhəmməd), **o şəxs kimi olanı ki,** (yəni o peyğəmbəri), **(مَرَّ عَلٰى قَرْيَةٍ) - yol əsnasında bir qəsəbədən keçdi.**

وَهِيَ خَاوِيَةٌ عَلٰى عُرُوشِهَاۚ قَالَ اَنّٰى يُحْيِ هٰذِهِ اللّٰهُ بَعْدَ مَوْتِهَاۚ فَاَمَاتَهُ اللّٰهُ مِائَةَ عَامٍ ثُمَّ بَعَثَهُۜ
قَالَ كَمْ لَبِثْتَۜ قَالَ لَبِثْتُ يَوْمًا اَوْ بَعْضَ يَوْمٍۜ قَالَ بَلْ لَبِثْتَ مِائَةَ عَامٍ فَانْظُرْ اِلٰى طَعَامِكَ
وَشَرَابِكَ لَمْ يَتَسَنَّهْۚ وَانْظُرْ اِلٰى حِمَارِكَ وَلِنَجْعَلَكَ اٰيَةً لِلنَّاسِ وَانْظُرْ اِلَى الْعِظَامِ كَيْفَ
نُنْشِزُهَا ثُمَّ نَكْسُوهَا لَحْمًاۜ فَلَمَّا تَبَيَّنَ لَهُۙ قَالَ اَعْلَمُ اَنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ﴿٢٥٩﴾

---

**(وَهِيَ خَاوِيَةٌ عَلٰى عُرُوشِهَا) – o qəsəbə elə bir halda idi ki, damı və tavanı onun üzərinə yıxılıb dağılmışdı. (قَالَ) –** (Üzeyir təəccüblə) **dedi: (اَنّٰى يُحْيِ هٰذِهِ اللّٰهُ بَعْدَ مَوْتِهَا) - öldükdən sonra Allah bunları necə dirildəcəkdir?** (Mən bu mətləbi dərk etməkdən acizəm). **(فَاَمَاتَهُ اللّٰهُ مِائَةَ عَامٍ) - Allah-Təala o anda onu öldürdü. 100 il ölü halda qaldı. (ثُمَّ بَعَثَهُ) - yüz ildən sonra Allah-Təala onu diriltdi, (قَالَ) - Allah-Təala ona xitab edib dedi: “Ey əziz, (كَمْ لَبِثْتَ) - nə qədər zaman ölü halda qalıbsan?” (قَالَ لَبِثْتُ يَوْمًا اَوْ بَعْضَ يَوْمٍ) –** (Üzeyir) **dedi: “Ölmək halətində bir gün, ya da bir gündən az”. (Üzeyirin ruhu alınanda günortadan əvvəl idi, amma diriəndə günəşin batmasına az qalmışdı. Ona görə əvvəl bir gün dedi, ondan sonra günəşə baxıb bir gündən az - dedi). (قَالَ بَلْ لَبِثْتَ مِائَةَ عَامٍ) –** (Allah-Təala) **dedi: “Əksinə, 100 il ölü halda qalıbsan. (فَانْظُرْ اِلٰى طَعَامِكَ وَشَرَابِكَ لَمْ يَتَسَنَّهْ) – yeməyinə** (əncirə, üzümə) **bax, içdiyinə** (südə) **bax, heç dəyişib zay olmayıbdır”.** (Üzeyir baxıb gördü ki, elə təzə qalıblar, amma bu mətləb Üzeyirin 100 il ölü qalmasına ondan ötrü dəlil olmadığından Allah-Təala ona ayrı bir dəlil göstərdi. Ta ki onu görüb özünün ölməyinə, yemək və içməyinin o uzun müddətdə təptəzə qalmasına inansın, bu səbəbdən buyurdu:) **(وَانْظُرْ اِلٰى حِمَارِكَ) – “**(ey Üzeyir)**, mindiyin ulağına bax gör, necə onun sümükləri dağılıb çürüyübdür”.** (Üzeyir dəhşət içində olduğundan diqqət etməmişdi, bu xitabı eşidən kimi diqqət edib gördü ki, həqiqətən, ulağının sümükləri çürüyüb məhv olubdur. Heyrətdə qalıb bildi ki, bunda bir sirr var)**. Ondan sonra xitab gəldi: “Ey Üzeyir, (وَلِنَجْعَلَكَ اٰيَةً لِلنَّاسِ) - səni öldürəndən sonra diriltdik ki, səni xalqdan ötrü əlamət edək, daha məhşər gününü inkar etməsinlər, bu ulağı ki, gördün, necə sümükləri dağılıb və parçalanıbdır, indi bax gör necə ona səndən ötrü həyat veririk. Biləsən ki, Allah-Təala ölənləri necə dirildir. (وَانْظُرْ اِلَى الْعِظَامِ)- ulağın sümüklərinə bax, (كَيْفَ نُنْشِزُهَا) – gör necə sümükləri bir-birinə birləşdiririk, (ثُمَّ نَكْسُوهَا لَحْمًا) - ondan sonra o sümüklərə ətdən libas geyindirib ona həyat verib dirildərik”.** (Üzeyir) **- ulağın sümüklərinə baxıb gördü ki, sümüklər bir-birinə qovuşub, ətə, qana gəlib, canlanıb dirildi, ulaq ayağa durub anqırdı.** (Üzeyir ulağın dirilməsində Allah-Təalanın qüdrətini gördü)**. (فَلَمَّا تَبَيَّنَ لَهُ) - O zaman ki Üzeyirə Allah-Təalanın ölü diriltmək qüdrəti aydın oldu, (قَالَ اَعْلَمُ اَنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) - dedi: “İndi mən agaham ki, Allah-Təala hər bir şeyə qadirdir”.**

وَاِذْ قَالَ اِبْرٰهِيمُ رَبِّ اَرِنِي كَيْفَ تُحْيِ الْمَوْتٰى ۜ قَالَ اَوَلَمْ تُؤْمِنْ ۜ قَالَ بَلٰى وَلٰكِنْ لِيَطْمَئِنَّ قَلْبِي ۜ قَالَ فَخُذْ اَرْبَعَةً مِنَ الطَّيْرِ فَصُرْهُنَّ اِلَيْكَ ثُمَّ اجْعَلْ عَلٰى كُلِّ جَبَلٍ مِنْهُنَّ جُزْءًا ثُمَّ ادْعُهُنَّ يَأْتِينَكَ سَعْيًا ۜ وَاعْلَمْ اَنَّ اللّٰهَ عَزِيزٌ حَكِيمٌ ﴿٢٦٠﴾ مَثَلُ الَّذِينَ يُنْفِقُونَ اَمْوَالَهُمْ فِي سَبِيلِ اللّٰهِ كَمَثَلِ حَبَّةٍ اَنْبَتَتْ سَبْعَ سَنَابِلَ فِي كُلِّ سُنْبُلَةٍ مِائَةُ حَبَّةٍ ۜ

---

**260) (وَاِذْ) - yadına sal,** (ey Məhəmməd)**, o zaman ki (قَالَ اِبْرٰهِيمُ) - İbrahim dua edib dedi: (رَبِّ اَرِنِي) - "Ey mənim rəbbim, göstər mənə ki, gözümlə görüm", (كَيْفَ تُحْيِ الْمَوْتٰى) - ölüləri necə dirildəcəksən? (قَالَ اَوَلَمْ تُؤْمِنْ) - Allah-Təala buyurdu: "Ey İbrahim, bəs iman gətirməyibsən ki, mən diriltməyə qadirəm?" (قَالَ بَلٰى) - İbrahim dedi: "Bəli, əlbəttə, iman gətirmişəm, (وَلٰكِنْ لِيَطْمَئِنَّ قَلْبِي) - bu sualı ona görə verirəm ki, gözlə aşkar görüb, qəlbim aram, imanım artıq olsun". (قَالَ) - Allah-Təala buyurdu: "İndi ki sən qəlbinin qəti bilməsindən ötrü xahiş edirsən, (فَخُذْ اَرْبَعَةً مِنَ الطَّيْرِ) -** 4 **ədəd quş tut. (فَصُرْهُنَّ اِلَيْكَ) - onları bir qədər özündə və əlində saxla. Onlara tam diqqət edib tanı ki. ölüb diriləndən sonra şübhən olmasın ki, bu quşlar o quşlar deyil. Elə ki diqqət etdin, onları öldür, ondan sonra o quşları bir-birinə qarışdırıb onları 4 parçaya ayır. (ثُمَّ اجْعَلْ عَلٰى كُلِّ جَبَلٍ مِنْهُنَّ جُزْءًا) -** 4 **parça edəndən sonra hər bir dağın üstünə o quşlardan bir parça qoy,** (yəni 4 parçanı 4 dağın üstünə qoy)**. (ثُمَّ ادْعُهُنَّ يَأْتِينَكَ سَعْيًا) - ondan sonra o quşları çağır, de ki, gəlin mənim tərəfimə. Allah-Təalanın izniylə o zaman o quşlar dirilib sənin tərəfinə sürətlə gələrlər.** (Hz. İbrahim necə ki əmr olunmuşdu, ona əməl edib, ondan sonra quşları çağırdı.Quşların parçaları bir-birinə bitişib, əvvəlki surətlərində Hz. İbrahimin hüzuruna gəldilər)**. (وَاعْلَمْ اَنَّ اللّٰهَ عَزِيزٌ حَكِيمٌ)–** (ya İbrahim)**, həqiqətən, bil ki, Allah-Təala bütün məxluqatına qalibdir, hikmət üzrə onları öldürüb dirildər.** (O* quşlar tovuz, xoruz, qarğa və ördək idi. "Ördək tamah, xoruz şəhvət Toyuq vəzifə arzusu, qarğa boş xəyaldır).

*(***Qeyd:** 4 quş insandakı 4 xəbis xüsusiyyətə işarədir, insan, gərək, o 4 xüsusiyyəti özündən yox etsin ki, kamil insan olsun. Tovuz təkəbbür və qürura işarədir, xoruz şəhvətə işarədir, qarğa sonsuz arzulara işarədir, ördək hirs və tamaha işarədir. Kim bu 4 xüsusiyyəti özündən kənar etsə, o zaman o şəxsə kamil insan deyilər. Bu xüsusiyyətləri özündən kənar edən ilk şəxs Hz. İbrahimdir. Kim Hz. İbrahimdən sonra o xüsusiyyətləri özündən kənar etsə, Hz. İbrahimin əxlaqı üzrə olub, ona tabe olacaqdır. Cəlaləddin Rumi (Allah ona rəhmət etsin) necə də düz deyib:*

**261) (مَثَلُ الَّذِينَ يُنْفِقُونَ اَمْوَالَهُمْ فِي سَبِيلِ اللّٰهِ) - Allah-Təala yolunda mallarını xərcləyib ehsan edən şəxslərin misalı, (كَمَثَلِ حَبَّةٍ) - bir toxumun misalı kimidir ki, o buğda toxumunu əkərsən, (اَنْبَتَتْ سَبْعَ سَنَابِلَ) - o toxum 7 sünbül olub göyərəndə, (فِي كُلِّ سُنْبُلَةٍ مِائَةُ حَبَّةٍ) - hər bir sünbüldə 100 ədəd buğda dəni olar,**

وَاللّٰهُ يُضَاعِفُ لِمَنْ يَشَآءُ وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ ﴿٢٦١﴾ اَلَّذِينَ يُنْفِقُونَ اَمْوَالَهُمْ فِي سَبِيلِ اللّٰهِ ثُمَّ لَا
يُتْبِعُونَ مَآ اَنْفَقُوا مَنًّا وَلَآ اَذًىۙ لَهُمْ اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْۚ وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٢٦٢﴾
قَوْلٌ مَعْرُوفٌ وَمَغْفِرَةٌ خَيْرٌ مِنْ صَدَقَةٍ يَتْبَعُهَآ اَذًىۜ وَاللّٰهُ غَنِيٌّ حَلِيمٌ﴿٢٦٣﴾

---

**(yəni necə ki Allah-Təala bir buğdadan 700 buğda verir, habelə ehsan edən kişilərə də birin əvəzinə 700 bəxşiş lütf edər). (وَاللّٰهُ يُضَاعِفُ لِمَنْ يَشَآءُ) - Allah-Təala kimə istəsə, əvəzini artırıb 700-dən də artıq bəxşiş verər. (وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ) - Allah-Təalanın rəhməti genişdir, xalqın əməlinə və ehsanına nə qədər istəsə, mükafat verər, ehsan edənlərin niyyətlərinə agahdır*, bilir ki, sırf Allah-Təaladan ötrü ehsan edirlər, yoxsa ehsan etməkdə başqa bir məqsədləri var).**

*(****Qeyd:** *Nə qədər yaxşı olar ki, varlı şəxslər bu ayənin məzmununa diqqət edib, qəlblərində ona yer versinlər. Ta ki ümmət yolunda mallarını sərf edib, onların tərəqqsinə və mədəniləşmələrinə bais olan hər bir lazımlı şeyi edib, imkanları nisbətində onları ehtiyacdan xilas etsinlər. Xüsusən onların təlim və tərbiyəsi xüsusunda cəhd, qeyrət göstərib öz vətən, millət övladlarını cəhalət və zəlalət vadisindən xilas edib, bu xeyir və gözəl olan əməldə var-dövlətlərini xərcləməkdən çəkinməsinlər. O vaxt həm Allah-Təala yanında əziz olub, böyük olan mükafata qovuşarlar, həm də dünyada özlərindən sonra gözəl əməllərini. adlarını millətin arasında yadigar qoyub gedərlər. (Hz. Əli buyurub: "Yaxşı mal odur ki şəxs onunla həm axirətini qazansın, həm də dünyada özlərindən sonra adları gözəl şəkildə yad olunsun"). Bir varlı şəxs özünü Quran əhli sayıb, amma bu ayəyə əməl etməsə, dünya malından xəzinələr toplayıb özündən sonra varislərə qoyub getsə, ona nəinki müsəlman, hətta insan da demək günahdır).*

**262) (اَلَّذِينَ يُنْفِقُونَ اَمْوَالَهُمْ فِي سَبِيلِ اللّٰهِ) - o şəxslər ki mallarını Allah-Təala yolunda xərcləyib ehsan edir,** (sümmə la yutbiunə ma ənfəqu mənna və la azzən) **(ثُمَّ لَا يُتْبِعُونَ مَآ اَنْفَقُوا مَنًّا وَلَآ اَذًى) - ondan sonra xərclədiklərinin arxasınca minnət və əziyyət göndərmir,** (yəni xərcləyəndən sonra nə bir minnət qoyurlar, nə də dillə əziyyət edirlər, əksinə, sırf Allah-Təala üçün ehsan edirlər), **(لَهُمْ اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْ) – onların əcr, savabı öz rəbləri Allah-Təala yanındadır. (وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ) - onlara nə qiyamət günündə qorxu olmaz, nə də məhzun və qəmgin olmazlar.**

**263) (قَوْلٌ مَعْرُوفٌ وَمَغْفِرَةٌ خَيْرٌ مِنْ صَدَقَةٍ يَتْبَعُهَآ اَذًى وَاللّٰهُ غَنِيٌّ حَلِيمٌ) - gözəl söz danışmaq, möhtac olanı yaxşı şəkildə yola salmaq, əgər möhtac olandan nalayiq əməl meydana gəlsə, ona güzəşt edib, əfv etmək sədəqənin arxasınca minnət və əziyyət etməkdən yaxşıdır. Allah-Təalanın minnət və əziyyət gətirən ehsana ehtiyacı yoxdur. Günahkarlara əzab etməkdə tələsən deyildir.**

يَآ اَيُّهَا الَّذينَ اٰمَنُوا لَا تُبْطِلُوا صَدَقَاتِكُمْ بِالْمَنِّ وَالْاَذٰى كَالَّذي يُنْفِقُ مَالَهُ رِئَآءَ النَّاسِ وَلَا يُؤْمِنُ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِۜ فَمَثَلُهُ كَمَثَلِ صَفْوَانٍ عَلَيْهِ تُرَابٌ فَاَصَابَهُ وَابِلٌ فَتَرَكَهُ صَلْدًاۜ لَا يَقْدِرُونَ عَلٰى شَيْءٍ مِمَّا كَسَبُواۜ وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرينَ ﴿٢٦٤﴾ وَمَثَلُ الَّذينَ يُنْفِقُونَ اَمْوَالَهُمُ ابْتِغَآءَ مَرْضَاتِ اللّٰهِ وَتَثْبيتًا مِنْ اَنْفُسِهِمْ كَمَثَلِ جَنَّةٍ بِرَبْوَةٍ اَصَابَهَا وَابِلٌ فَاٰتَتْ اُكُلَهَا ضِعْفَيْنِۚ فَاِنْ لَمْ يُصِبْهَا وَابِلٌ فَطَلٌّۜ

---

**264) (يَآ اَيُّهَا الَّذينَ اٰمَنُوا) - ey iman gətirən şəxslər, (لَا تُبْطِلُوا صَدَقَاتِكُمْ بِالْمَنِّ وَالْاَذٰى) - sədəqə və ehsanınızı minnət qoyub əziyyət etməklə batil etməyin, (كَالَّذي يُنْفِقُ مَالَهُ) - o şəxsin sədəqə və ehsanının batil olması kimi, hansı ki malını xərcləyib ehsan edir, (رِئَآءَ النَّاسِ)- xalqın görməsindən ötrü,** (yəni xalq onu tərifləyib desin ki, nə yaxşı səxavətli şəxsdir), **Allah-Təalanın məmnunluğundan ötrü ehsan etməz, bu şəxsin əməli riya səbəbinə Allah-Təala yanında batildir. Habelə sədəqə verib minnət qoyan şəxsin əməli də batildir. (وَلَا يُؤْمِنُ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) - belə şəxs Allah-Təalaya və qiyamət gününə iman gətirən deyildir. Allah-Təalaya iman gətirən şəxsin hər bir əməli gərək Allah-Təaladan ötrü olsun. (فَمَثَلُهُ كَمَثَلِ صَفْوَانٍ عَلَيْهِ تُرَابٌ) – sədəqədən mənfəət qazanmayan riyakar şəxsin misalı o daşın misalı kimidir ki, onun üzündə bir qədər torpaq olsun, (فَاَصَابَهُ وَابِلٌ) - o daşa iri damlalı yağış yağıb, (فَتَرَكَهُ صَلْدًا) - o yağış o daşın üzərində olan** (cüzi) **torpağı aparıb o daşı torpaqsız daş etsin. Necə ki daşın üstündə olan bu cüzi torpaqdan mənfəət əldə etmək olmaz, qüvvətli yağış gələndə o torpağı tamam dağıdıb daşı torpaqsız qoyar, habelə riyakar və ya əziyyəti minnətlə sədəqə verən şəxslər də öz əməllərindən mənfəət əldə etməzlər. (لَا يَقْدِرُونَ عَلٰى شَيْءٍ مِمَّا كَسَبُوا) – qeyd olunan şəxslərin əməlləri sırf Allah-Təaladan ötrü olmadığından dünyada etdikləri əməllərdən heç bir savaba qadir** (nail) **olmazlar. (وَاللّٰهُ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرينَ) - Allah-Təala kafir olan riyakarları və sədəqə verib minnət qoyanları haqq tərəfinə hidayət etməz.** (Ayənin axırında bu kəlamı qeyd etmək buna işarədir ki, minnət və əziyyətlə sədəqə verənlər, riyakarlar Allah-Təalaya görə, kafir şəxslər kimidir).

**265) (وَمَثَلُ الَّذينَ يُنْفِقُونَ اَمْوَالَهُمُ ابْتِغَآءَ مَرْضَاتِ اللّٰهِ) - Allah-Təalanın məmnunluğunu istəməkdən ötrü* mallarını xərcləyib ehsan edən şəxslərin məsəli, (وَتَثْبيتًا مِنْ اَنْفُسِهِمْ) - bir də nəfslərini ehsan verməkdə sabit edib, Allah-Təala yolunda maldan keçməyə adət edib, sədəqə və ehsan verən şəxslərin məsəli, (كَمَثَلِ جَنَّةٍ بِرَبْوَةٍ) - o bağın misalı kimidir ki, o bağ uca bir təpədə yerləşmiş olsun. (اَصَابَهَا وَابِلٌ) - o bağa iri damlalı yağış yağsın, (فَاٰتَتْ اُكُلَهَا ضِعْفَيْنِ) - o vaxt da o bağ yeri əlverişli olduğuna görə, ikiqat meyvə verər. (فَاِنْ لَمْ يُصِبْهَا وَابِلٌ فَطَلٌّ) - o bağ yeri əlverişli olduğundan o bağa bol yağış yağmasa da, az və cüzi olan yağış da ona kifayət edib meyvə verər.** (Allah-Təalanın məmnunluğundan ötrü sədəqə və ehsan verənlər də belədir, hərçənd az da

وَاللّٰهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿٢٦٥﴾ اَيَوَدُّ اَحَدُكُمْ اَنْ تَكُونَ لَهُ جَنَّةٌ مِنْ نَخِيلٍ وَاَعْنَابٍ تَجْرِي مِنْ
تَحْتِهَا الْاَنْهَارُ لَهُ فِيهَا مِنْ كُلِّ الثَّمَرَاتِ وَاَصَابَهُ الْكِبَرُ وَلَهُ ذُرِّيَّةٌ ضُعَفَاءُ فَاَصَابَهَا اِعْصَارٌ
فِيهِ نَارٌ فَاحْتَرَقَتْ كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ لَعَلَّكُمْ تَتَفَكَّرُونَ ﴿٢٦٦﴾

---

versə, Allah-Təala onu artırıb ona böyük əcr, savablar verər). (وَاللّٰهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ) **- Allah-Təala etdiyiniz hər bir əməldən agahdır.** (Haqq Təala gələn ayədə o şəxsləri misal verir ki, sədəqə və ehsanlarında minnət qoyub əziyyət edirlər).

*(***Qeyd:** Dünya malı insana canından əzizdir, insan üçün dünya malından keçmək çox məşəqqətlidir, millət, din yolunda mal xərcləmək cihad edib özünü qurban etməyə bərabərdir. Hətta daha artıqdır. Çünki mal xərcləməklə əldə edilən tərəqqi candan keçməklə mümkün olmaz. Maldan keçib millətin övladlarını oxutmaq Allah-Təala yolunda cihad etməkdən daha üstündür. (Hz. Peyğəmbər buyurubdur: "Üləmaların mürəkkəbi şəhidlərin qanından üstündür". Mal və dövlət sahibi olmaq uca bir mənsəbdir. Bu şərtlə ki, var-dövlət sahibi olan şəxs öz malını din və ümmətin tərəqqisi yolunda sərf etsin).*

**266) (اَيَوَدُّ اَحَدُكُمْ اَنْ تَكُونَ لَهُ جَنَّةٌ مِنْ نَخِيلٍ وَاَعْنَابٍ) - sizdən biri heç istəyər ki, ondan ötrü xurma və üzüm ağaclarından ibarət bir bağ olsun, (تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) - o bağın ağaclarının və qəsrlərinin altından çaylar axsın, (لَهُ فِيهَا مِنْ كُلِّ الثَّمَرَاتِ) - o şəxsdən ötrü o bağda xurma və üzümdən başqa da bütün meyvələrdən olsun,** (Əlbəttə, belə bir bağın olmasını hər kəs istəyər), **(وَاَصَابَهُ الْكِبَرُ) – və belə bir halda o bağ sahibinə qocalıq üz versin, (وَلَهُ ذُرِّيَّةٌ ضُعَفَاءُ) - o qoca şəxsin kiçik övladı olub, yaşamaq üçün o bağa möhtac olsunlar? (فَاَصَابَهَا اِعْصَارٌ) - belə bir ehtiyac məqamında o bağa bir şiddətli bir qasırğa gəlsə, (فِيهِ نَارٌ) - o qasırğanın içində bir od olsa, (فَاحْتَرَقَتْ) - o bağ o qasırğada olan od səbəbinə yanıb tələf olsa, belə bir şeyi istərsinizmi? Əlbəttə, istəməzsiniz, əgər belə bir şey olsa, sizin üçün nə qədər peşmançılıq olar? (Dünyada riya ilə sədəqə və ehsan verən, ya da ehsanlarında minnət qoyub əziyyət edən şəxslərin əhvalı da belədir. Belə şəxslər qiyamət günündə xəyal edərlər ki, bizim yaxşı əməllərimiz vardır, bu gün o əməllərin səbəbinə nicat taparıq. Qəfildən onlara məlum olar ki, sizin əməlləriniz o bağ kimi riya, minnət və əziyyət odu ilə yanıb tələf olubdur. Bu gündə ki sizin o əməllərə daha çox ehtiyacınız vardır, o əməllərdən sizə heç bir fayda gəlməz. Necə ki o bağdan bağ sahibinə ehtiyac anında heç bir mənfəət gəlmədi. (كَذٰلِكَ يُبَيِّنُ اللّٰهُ لَكُمُ الْاٰيَاتِ) - Allah-Təala sizdən ötrü öz ayə və ehkamını belə bəyan edər. (لَعَلَّكُمْ تَتَفَكَّرُونَ) - əlbəttə, siz gərək təfəkkür edəsiniz ki, dünya fani, axirət əbədidir, dünya malını toplayıb yığmaqla bir fayda gəlməz, ancaq Allah-Təaladan ötrü millət, din və məzhəb yolunda sərf olunsa, fayda verər.**

يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اَنْفِقُوا مِنْ طَيِّبَاتِ مَا كَسَبْتُمْ وَمِمَّآ اَخْرَجْنَا لَكُمْ مِنَ الْاَرْضِ وَلَا تَيَمَّمُوا الْخَبِيثَ
مِنْهُ تُنْفِقُونَ وَلَسْتُمْ بِاٰخِذِيهِ اِلَّا اَنْ تُغْمِضُوا فِيهِ وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ غَنِيٌّ حَمِيدٌ ﴿٢٦٧﴾ اَلشَّيْطَانُ يَعِدُكُمُ
الْفَقْرَ وَيَاْمُرُكُمْ بِالْفَحْشَآءِ وَاللّٰهُ يَعِدُكُمْ مَغْفِرَةً مِنْهُ وَفَضْلًا وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ ﴿٢٦٨﴾ يُؤْتِي الْحِكْمَةَ
مَنْ يَشَآءُ وَمَنْ يُؤْتَ الْحِكْمَةَ فَقَدْ اُوتِيَ خَيْرًا كَثِيرًا وَمَا يَذَّكَّرُ اِلَّا اُولُوا الْاَلْبَابِ ﴿٢٦٩﴾

---

**267) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا) - ey iman gətirən şəxslər, (اَنْفِقُوا مِنْ طَيِّبَاتِ مَا كَسَبْتُمْ) - qazandığınız şeyin pak və ən yaxşısından sədəqə və ehsan verin.** (Bizim bəzi gəmi sahibi olan bəndələrimiz kimi ehsan etməyin, gəmiləri dənizdə fırtınaya düşüb, gəmidəki düyü dəniz suyu ilə islandığı üçün müştərilər onu almadıqda, o tacir çaşıb qalar, bir qədər fikirləşəndən sonra isə verməsi vacib olan xüms, zəkat, ya da sədəqəni hesablayıb, o düyünü kasıblara ehsan edər. Kasıblar da naəlac qalıb o düyünü yeyəndən sonra zəhərlənib, ya mədə, ya da qarın ağrısına, ya da bağırsaq, iltihab xəstəliyinə düçar olub qırılarlar. Ey mənim bəndələrim, siz də bu gəmi sahibləri kimi mənim yolumda sədəqə verməyin. Əksinə, qızıl-gümüşünüzdən mənim yolumda keçib ümmətin övladlarına yardımçı olun). **(وَمِمَّآ اَخْرَجْنَا لَكُمْ مِنَ الْاَرْضِ) - və o şeyləri** (meyvə və yeraltı sərvətlər) **ki, sizdən ötrü yerdən çıxarmışam, onların da ən yaxşısını sədəqə olaraq verin. (وَلَا تَيَمَّمُوا الْخَبِيثَ مِنْهُ تُنْفِقُونَ) - malın pis və qüsurlusunu Allah-Təala yolunda sədəqə verməyə niyyət etməyin, (وَلَسْتُمْ بِاٰخِذِيهِ) - halbuki sizin bir nəfərdə haqqınız qalsa, sizə pis və qüsurlu mal versə, onu almazsınız, bəs qüsurlu olan malı Allah-Təala yolunda necə verirsiniz? (اِلَّا اَنْ تُغْمِضُوا فِيهِ) –o qüsurlu olan malı ancaq məcburiyyətdən – o qüsurlu olandan başqasını vermədiklərində və ya başqası olmadıqda gözünüzü yumub alarsınız. Sizdən ötrü malın yaxşısını vermək mümkün olan surətdə nə səbəbə görə, malın pis və qüsurlusunu verirsiniz? (وَاعْلَمُوٓا اَنَّ اللّٰهَ غَنِيٌّ حَمِيدٌ) - bunu da bilin ki, Allah-Təala sizə möhtac deyildir. Bu sədəqə və ehsanın mənfəəti sizə aiddir. Allah-Təala bütün işlərində bəyəniləndir.**

**268) (اَلشَّيْطَانُ يَعِدُكُمُ الْفَقْرَ) - şeytan** (nəfsi-əmmarə) **sizə əgər malınızı ehsan etsəniz, yoxsulluğu vəd edir,** (yəni sədəqə versəniz, malınız qurtarar). **(وَيَاْمُرُكُمْ بِالْفَحْشَآءِ) - şeytan sizə xəsisliyi və sədəqə verməməyi əmr edir. (وَاللّٰهُ يَعِدُكُمْ مَغْفِرَةً مِنْهُ وَفَضْلًا) - amma Allah-Təala sədəqənin əvəzində öz tərəfindən günahkarın bağışlanmasını və axirətdə artıq savab verməyi vəd edir. (وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ) - Allah-Təalanın rəhməti və əfvi genişdir. Verdiyiniz sədəqə və ehsanlardan agahdır.**

**269) (يُؤْتِي الْحِكْمَةَ مَنْ يَشَآءُ) - Allah-Təala hikməti** (yəni elmi və onunla əməl etməyi) **istədiyinə verər,* (وَمَنْ يُؤْتَ الْحِكْمَةَ)** (Allah-Təala kimə hikmət versə), **(فَقَدْ اُوتِيَ خَيْرًا كَثِيرًا) - həqiqətən, o şəxsə çox xeyir verilibdir.** (Əlbəttə, hikmət və elmdən xeyirli nə var?) **(وَمَا يَذَّكَّرُ اِلَّا اُولُوا الْاَلْبَابِ) - Allah-Təalanın**

وَمَٓا اَنْفَقْتُمْ مِنْ نَفَقَةٍ اَوْ نَذَرْتُمْ مِنْ نَذْرٍ فَاِنَّ اللّٰهَ يَعْلَمُهُ ۜ وَمَا لِلظَّالِمٖينَ مِنْ اَنْصَارٍ ﴿٢٧٠﴾ اِنْ تُبْدُوا
الصَّدَقَاتِ فَنِعِمَّا هِيَ ۚ وَاِنْ تُخْفُوهَا وَتُؤْتُوهَا الْفُقَرَٓاءَ فَهُوَ خَيْرٌ لَكُمْ ۜ وَيُكَفِّرُ عَنْكُمْ مِنْ
سَيِّاٰتِكُمْ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبٖيرٌ ﴿٢٧١﴾

---

**nəsihət və ehkamını elm və hikmət, ağıl sahibi olan şəxslərdən başqası qəbul etməz.** Cahil şəxslər Allah-Təalanın kəlamından heç bir şey dərk edə bilməzlər.** (Bu ayədən məqsəd insanları ehsan və sədəqə ayələrinə əməl etməyə həvəsləndirməkdir. Kim o ayələrin məzmununa əməl etsə, din və ümmət yolunda malından keçsə, ümmətin övladlarına tərbiyə versə, Allah-Təala ona bol xeyir bəxş edər. Hikmət sahibi Allah-Təalanın hökmlərinə əməl edən şəxsdir).

*(****Qeyd:*** *Allah-Təalaya görə, hikmət elm mənasındadır. Hikmət sahibi alim odur ki, elminə əməl etsin).*

*(*****Qeyd:*** *Bütün elm və hikmətin əsası ağıldır. Hz. Peyğəmbər buyurdu: "Ey Əli, insanların hər biri Allah-Təalaya bir şeylə yaxınlaşar. Amma sən Allah-Təalaya ağlınla yaxınlaş. Padşahların kəlamı kəlamların padşahıdır. Elm dəryasından belə kəlam meydana gələr").*

**270) (وَمَٓا اَنْفَقْتُمْ مِنْ نَفَقَةٍ) – (Allah-Təala, ya da şeytan yolunda) nə ki sədəqə və ehsan versəniz, (اَوْ نَذَرْتُمْ مِنْ نَذْرٍ) - ya da Allaha itaət, ya da günah üçün nə nəzir etsəniz, (فَاِنَّ اللّٰهَ يَعْلَمُهُ) - həqiqətən, Allah-Təala o sədəqə və o nəzirdən agahdır, hər bir şəxsə öz niyyətinə görə qarşılıq verəcəkdir. (وَمَا لِلظَّالِمٖينَ مِنْ اَنْصَارٍ)** – (o zalımlar ki, ehsan və sədəqə verməyi tərk edir)**, Allah-Təalanın əzabından onlara bir kömək edən və ilahi əzaba mane olan olmayacaqdır.**

**271) (اِنْ تُبْدُوا الصَّدَقَاتِ) - əgər yoxsula sədəqə verəndə aşkar versəniz, bəlkə, digər şəxslər də sizə baxıb sədəqə verər. (فَنِعِمَّا هِيَ) - bu cür aşkar sədəqə vermək nə yaxşı və gözəldir. (وَاِنْ تُخْفُوهَا) - əgər sədəqəni gizlədib (وَتُؤْتُوهَا الْفُقَرَٓاءَ) - yoxsula gizlində versəniz, (فَهُوَ خَيْرٌ لَكُمْ) – belə vermək sizin üçün daha yaxşıdır.** (Çünki gizlin sədəqə və ehsanda riya olmaz). **(وَيُكَفِّرُ عَنْكُمْ مِنْ سَيِّاٰتِكُمْ) - o gizlin sədəqə verməyiniz günahlarınızdan bəzisini örtüb sizdən kənar edər.** (Allah-Təala bəzi günahlarınızı o gizlin sədəqə vermək səbəbinə bağışlayar). **(وَاللّٰهُ بِمَا تَعْمَلُونَ خَبٖيرٌ) - Allah-Təala etdiyiniz hər bir şeydən xəbərdar və agahdır, sədəqəni gizlin, ya da aşkar versəniz, Allah-Təala hər ikisindən də agahdır.** (Hz. Peyğəmbərin zamanında müsəlmanların kafir və münafiq qohum-əqrəbaları var idi. Onlara islamdan qabaq sədəqə və ehsan verirdilər. Müsəlman olandan sonra onlara sədəqə və ehsan verməyi dayandırdılar ki, bəlkə, məcbur qalıb islama daxil olsunlar. Hz. Peyğəmbər insanların müsəlman olmasını çox istədiyindən müsəlmanların bu hərəkətinə razı oldu ki, bəlkə, sədəqə və ehsanın dayandırılmasına görə, müsəlman olsunlar. O vaxt bu ayə nazil oldu).

لَيْسَ عَلَيْكَ هُدٰيهُمْ وَلٰكِنَّ اللّٰهَ يَهْدِي مَنْ يَشَٓاءُ وَمَا تُنْفِقُوا مِنْ خَيْرٍ فَلِاَنْفُسِكُمْ وَمَا تُنْفِقُونَ اِلَّا ابْتِغَٓاءَ
وَجْهِ اللّٰهِ وَمَا تُنْفِقُوا مِنْ خَيْرٍ يُوَفَّ اِلَيْكُمْ وَاَنْتُمْ لَا تُظْلَمُونَ ﴿٢٧٢﴾ لِلْفُقَرَٓاءِ الَّذِينَ اُحْصِرُوا فِي
سَبِيلِ اللّٰهِ لَا يَسْتَطِيعُونَ ضَرْبًا فِي الْاَرْضِ يَحْسَبُهُمُ الْجَاهِلُ اَغْنِيَٓاءَ مِنَ التَّعَفُّفِ تَعْرِفُهُمْ بِسِيمٰيهُمْ لَا
يَسْـَٔلُونَ النَّاسَ اِلْحَافًا وَمَا تُنْفِقُوا مِنْ خَيْرٍ فَاِنَّ اللّٰهَ بِهٖ عَلِيمٌ ﴿٢٧٣﴾

---

**272) (لَيْسَ عَلَيْكَ هُدٰيهُمْ) -** (ey Məhəmməd)**, xalqı hidayət edib hökmən islama daxil etmək sənə həvalə edilməyibdir ki, kafirlərin islama daxil olmasına görə, sədəqə və ehsanın dayandırılmasına razı olasan. Sən müjdələyən və qorxudansan. Ehkamı təbliğ etmək sənə vacibdir. (وَلٰكِنَّ اللّٰهَ يَهْدِي مَنْ يَشَٓاءُ) - lakin Allah-Təala kimi istəsə, ona yardım edib, islama hidayət edər. Sən ancaq Allahın ehkamını xalqa çatdır.** (Siz möminlər kafir qohum-əqrəbalarınıza sədəqə və ehsan verin, islama daxil oldular, ya da olmadılar, fərqi yoxdur, o əcr və savab ki, sədəqə verməyiniz səbəbi ilə Allah-Təala yanında vardır, sizə yetişəcəkdir). **(وَمَا تُنْفِقُوا مِنْ خَيْرٍ فَلِاَنْفُسِكُمْ) - ey möminlər, maldan nə ki, sədəqə verirsiniz, onun mənfəəti özünüzə aid olar, (وَمَا تُنْفِقُونَ اِلَّا ابْتِغَٓاءَ وَجْهِ اللّٰهِ) - siz ancaq Allah-Təalanın məmnunluğu üçün sədəqə verirsiniz, bəs qeyri-müsəlmanlara sədəqə verməyi tərk edirsiniz? Halbuki sədəqə almaqda müsəlman və müsəlman olmayanlar bərabərdir. (وَمَا تُنْفِقُوا مِنْ خَيْرٍ يُوَفَّ اِلَيْكُمْ) - maldan nə ki sədəqə verirsiniz, onun əcri və savabı ondan da artıq sizə yetişəcəkdir. (وَاَنْتُمْ لَا تُظْلَمُونَ) - əməllərinizin savabı azalmayıb, sizə zülm olunmayacaqdır, əksinə, Allah-Təala əməllərinizin savabını daha artıq şəkildə sizə yetirəcəkdir.** (Növbəti ayə cihadda şikəst olan şəxslərin barəsində nazil olubdur)**.**

**273) (لِلْفُقَرَٓاءِ الَّذِينَ اُحْصِرُوا فِي سَبِيلِ اللّٰهِ) - sədəqə və ehsan o yoxsullara lazımdır ki, həmişə Allah-Təala yolunda cihad edib, o cihad səbəbinə bəzi orqanlarını itiriblər. (لَا يَسْتَطِيعُونَ ضَرْبًا فِي الْاَرْضِ) – bəzi orqanlarını itirdiklərinə görə, yer üzündə hərəkət etməyə, məişətlərini təmin etməyə qüdrətləri olmayıb, həyatlarını son dərəcə yoxsulluq və pərişanlıq içində keçirdirlər, (يَحْسَبُهُمُ الْجَاهِلُ اَغْنِيَٓاءَ مِنَ التَّعَفُّفِ) - o səbəbə görə ki, o yoxsullar özlərini dilənçilik etməkdən saxlayırlar. Cahil və nadan olan şəxslər onları varlı və ehtiyacsız güman edərlər. (تَعْرِفُهُمْ بِسِيمٰيهُمْ) -** (ey Məhəmməd)**, əgər sən onlara diqqətlə baxsan, onların yoxsul olduğunu üzlərindən anlayarsan. (لَا يَسْـَٔلُونَ النَّاسَ اِلْحَافًا) – insanları sıxışdırıb dilənçilik edib israrla bir şey istəməzlər,** (Necə ki bizim dövrdəki dilənçilər istəyir)**. Əksinə, aclığa səbir edib heç vaxt dilənçilik etməzlər. (وَمَا تُنْفِقُوا مِنْ خَيْرٍ) - cihadda orqanlarını itirən yoxsullara nə sədəqə versəniz, (فَاِنَّ اللّٰهَ بِهٖ عَلِيمٌ) - həqiqətən, Allah-Təala o şeydən agahdır və onun qarşılığını sizə verəcəkdir.**

اَلَّذٖينَ يُنْفِقُونَ اَمْوَالَهُمْ بِالَّيْلِ وَالنَّهَارِ سِرًّا وَعَلَانِيَةً فَلَهُمْ اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْۚ وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ
يَحْزَنُونَ ﴿٢٧٤﴾ اَلَّذٖينَ يَاْكُلُونَ الرِّبٰوا لَا يَقُومُونَ اِلَّا كَمَا يَقُومُ الَّذٖي يَتَخَبَّطُهُ الشَّيْطَانُ مِنَ الْمَسِّۜ

---

**274) (اَلَّذٖينَ يُنْفِقُونَ اَمْوَالَهُمْ بِالَّيْلِ وَالنَّهَارِ سِرًّا وَعَلَانِيَةً فَلَهُمْ اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْۚ وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ) - o şəxslər ki mallarını gecə-gündüz gizlində və aşkarda Allah-Təala yolunda xərcləyirlər, onların əcr, savabları rəbləri Allah-Təala yanındadır, qiyamət gününün əzabından onlara qorxu yoxdur, nə də qəmgin və məhzun olmazlar.** (Zəməxşəri "Təfsiri-Kəşşaf"da qeyd edir: "bəziləri deyib ki, (məlum deyil bu şəxs kimdir?) bu ayə Əbu Bəkr haqqında nazil olubdur. 40 min* dinar sədəqə verdi, ondan sonra deyir: "İbn Abbasdan rəvayət olunubdur ki, bu ayə Əli ibn Əbu Talibin haqqında nazil olubdur. 4 dirhəmi var idi. Birini gecə, birini gündüz, birini gizlin, birini aşkarda sədəqə verdi". Ayə Hz. Əli, ya da Əbu Bəkir haqqında nazil olsa da, ayənin hökmü ümumidir. Kim sədəqə versə, həmin əcr, savab ona yetişəcəkdir. Ayənin Əbu Bəkir haqqında olduğunu rəvayət edən şəxs əgər 40 min dinar əvəzinə 40 min dirhəm desə idi, daha inandırıcı olardı). Növbəti ayə sələmçilər haqqında nazil olubdur).

*(*__Qeyd:__ Hər dinar bir misqal qızıldır).*

**275) (اَلَّذٖينَ يَاْكُلُونَ الرِّبٰوا) - o şəxslər ki borc verib faiz** (sərmayədən artıq) **alıb, o faizi yeyir, (لَا يَقُومُونَ) - qiyamət günündə qəbirlərindən durmazlar, (اِلَّا كَمَا يَقُومُ الَّذٖي يَتَخَبَّطُهُ الشَّيْطَانُ مِنَ الْمَسِّ) - şeytanın onu vurduğu kimi** (durub), **o vurmaqdan dəliliyə* düçar olub, ya da bayılarlar.** (Necə ki dəli və ya epilepsiyalı şəxs ayaq üstə dura bilməyib üzü üstə yıxılar, habelə sələmçi də qiyamət günündə üzü üstə məhşərə gələr, faiz yeməkdən onun qarnı o qədər şişər ki, qarnının əzəmətindən ayağa durmağa qadir olmayıb üzü üstə yerə yıxılar)**.**

*(*__Qeyd:__ Ərəblərin etiqadına görə, şeytan və cinin insana çarpması ilə o, ya dəli, ya da epilepsiyalı olar. Necə ki indi də bizim zəmanəmizdə bu etiqad xalqın arasında məşhur və yayğındır. Bunların hamısı yalan və xurafatdır. Ayə sələmçilərin xüsusiyyətini ərəblərin inancına görə bildiribdir. Ərəblərin cinlər haqqında əcaib və qəribə hekayələri vardır. Onları inkar edən şəxs guya açıq-aşkar bir şeyi inkar edər. Bizim bu zəmanəmiz ərəblərin cahiliyyə zamanı kimidir. Yer üzündə olan millətlərin arasında elm və bilik nuru artdıqca, tərəqqi tapdıqca bizim ümmətimizin arasında yalan, xurafat, batil sözlər artıb rəvac tapır. Cinlərdən ötrü qissələr və hekayələr tərtib edib, onun arxasınca birdən 100-ə qədər , bəlkə də daha artıq qiyməti olan dualar yazıblar. Qızdırma xəstəliyinə düçar olan biçarələr dua yazan mollalara gedib, mollalar da onun bədənində qan zəhərlənməsindən meydana gələn göy rəngləri cin vurmaq əlaməti kimi nişan verib, pulla dualar yazırlar. Bir çox şəxslər bu yolla tələf olurlar. (Xalqı məhv edən bu xəbis*

ذٰلِكَ بِاَنَّهُمْ قَالُوٓا اِنَّمَا الْبَيْعُ مِثْلُ الرِّبٰواۢ وَاَحَلَّ اللّٰهُ الْبَيْعَ وَحَرَّمَ الرِّبٰواۜ فَمَنْ جَٓاءَهُ مَوْعِظَةٌ مِنْ رَبِّهٖ فَانْتَهٰى فَلَهُ مَا سَلَفَۜ وَاَمْرُهُٓ اِلَى اللّٰهِۜ وَمَنْ عَادَ فَاُو۬لٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فٖيهَا خَالِدُونَ ﴿٢٧٥﴾
يَمْحَقُ اللّٰهُ الرِّبٰوا وَيُرْبِي الصَّدَقَاتِۜ وَاللّٰهُ لَا يُحِبُّ كُلَّ كَفَّارٍ اَثٖيمٍ﴿٢٧٦﴾

---

*cinlər özlərindən başqa cinlərə də inanır?) Bir də hər bir pis və xəbis əməl şeytana isnad edilir. O səbəbdən ayədə epilepsiya və dəlilik şeytana isnad edildi).*

**(ذٰلِكَ) – sələmçilərin belə üzüüstə məhşərə gəlmələri, (بِاَنَّهُمْ قَالُوٓا) - o səbəbə görədir ki, onlar dedilər: (اِنَّمَا الْبَيْعُ مِثْلُ الرِّبٰوا) - həqiqətdə, alış-veriş faiz kimidir. Hər ikisi alış-verişdir. Necə ki alış-veriş halaldır, habelə faiz də halaldır.** (Bu sözə görə, Allah-Təala sələmçiləri üzüüstə məhşərə gətirər)**. Belə deyil ki, onlar deyirlər: (وَاَحَلَّ اللّٰهُ الْبَيْعَ) - halbuki Allah-Təala alış-verişi halal edib, (وَحَرَّمَ الرِّبٰوا) – amma faizi də haram edibdir.** (Necə ola bilər ki, alış-veriş, faiz kimi olsun)**. (فَمَنْ جَٓاءَهُ مَوْعِظَةٌ مِنْ رَبِّهٖ) – faiz barəsində** (haram olması haqda) **Allah-Təala tərəfindən kimə bir öyüd-nəsihət gəlsə, (فَانْتَهٰى) - o şəxs də o nəsihəti qəbul edib faiz yeməkdən özünü saxlayıb kənar olsa, (فَلَهُ مَا سَلَفَ) - keçmiş zamanlarda yediyi faizlər bağışlanar, (وَاَمْرُهُٓ اِلَى اللّٰهِ) – faiz barəsində onun işi Allah-Təalaya həvalə edilibdir. Allah-Təala onun faiz barəsində olan günahını bağışlayar, siz o şəxsə deyə bilməzsiniz ki, sən sələmçisən, çünki bu əmələ faiz hökmündən əvvəl bulaşmışdı. (وَمَنْ عَادَ) - kim faizin haram olması elan olandan sonra yenə faiz yeməyə dönsə, (فَاُو۬لٰٓئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فٖيهَا خَالِدُونَ) - onlar cəhənnəm yoldaşlarıdır və onlar orada həmişəlik qalarlar, heç vaxt əzabdan xilas ola bilməzlər.** (Müsəlmanlar nədən bu ayəyə fikir verməyib, 5 günlük dünya ləzzətindən ötrü sələmçiliyi özlərinə şüar edib əbədi əzabi seçirlər? İnsaf və mürüvvətdən kənar olub Allah-Təalanın məxluqatının qanını sorurlar? Necə ki ağcaqanad öz iynəsi ilə insanın qanını sorur, sələmçilər də möhtac şəxslərə qarşılıqsız borc vermək əvəzində onlardan faiz alırlar, o biçarə axırda o məbləği verə bilməyib, ehtiyacı olan əşyalarını satıb insafsız sələmçinin faizini qaytarar. Bu insafsızın əməli insanlıq, din və məzhəb yoludur? Əlbəttə, heç bir din və məzhəb belə bir işi rəva görməz. Bu faiz hökmü yoxsul şəxslərə aiddir. Amma zəngin şəxslərin ticarət işlərində borc alıb-verərkən etdikləri iş bu faiz hökmünün xaricindədir).

**276) (يَمْحَقُ اللّٰهُ الرِّبٰوا وَيُرْبِي الصَّدَقَاتِۜ وَاللّٰهُ لَا يُحِبُّ كُلَّ كَفَّارٍ اَثٖيمٍ) - Allah-Təala faizin bərəkətini götürüb, o mal ki ona faiz daxil olub, onu yox edər, amma sədəqələrin isə savabını artırar. Allah-Təala kafir və günahkar şəxsləri sevməz.** (Bu ayədə Allah-Təala işarə edir ki, faiz yemək, sədəqəni tərk etmək kafirlərin əməlidir. Faiz yemək böyük günahdır. Böyük günah sahibi dünyadan tövbəsiz gedəndə kafir hökmündədir. Cəhənnəmdə həmişəlik qalacaqdır).

اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَاَقَامُوا الصَّلٰوةَ وَاٰتَوُا الزَّكٰوةَ لَهُمْ اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْۚ وَلَا خَوْفٌ
عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٢٧٧﴾ يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ وَذَرُوا مَا بَقِيَ مِنَ الرِّبٰٓوا اِنْ كُنْتُمْ
مُؤْمِنِينَ ﴿٢٧٨﴾ فَاِنْ لَمْ تَفْعَلُوا فَاْذَنُوا بِحَرْبٍ مِنَ اللّٰهِ وَرَسُولِهٖۚ وَاِنْ تُبْتُمْ فَلَكُمْ رُؤُسُ اَمْوَالِكُمْۚ لَا
تَظْلِمُونَ وَلَا تُظْلَمُونَ ﴿٢٧٩﴾ وَاِنْ كَانَ ذُو عُسْرَةٍ فَنَظِرَةٌ اِلٰى مَيْسَرَةٍۜ وَاَنْ تَصَدَّقُوا خَيْرٌ لَكُمْ اِنْ
كُنْتُمْ تَعْلَمُونَ ﴿٢٨٠﴾

---

**277) (اِنَّ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ وَاَقَامُوا الصَّلٰوةَ وَاٰتَوُا الزَّكٰوةَ لَهُمْ اَجْرُهُمْ عِنْدَ رَبِّهِمْۚ وَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ) - həqiqətən, o şəxslər ki iman edib saleh əməl edir, namaz qılıb zəkat verir, o şəxslərin əcr, savabları rəbləri Allah-Təalanın yanındadır. Qiyamət günündə axirət əzabından onlara heç bir qorxu yoxdur. Məhzun və qəmgin də olmazlar.**

**278) (يَٓا اَيُّهَا الَّذِينَ اٰمَنُوا اتَّقُوا اللّٰهَ وَذَرُوا مَا بَقِيَ مِنَ الرِّبٰٓوا اِنْ كُنْتُمْ مُؤْمِنِينَ) – (Məkkə əhlindən bəzisi Taif əhlinə borclu idilər. Faizin yarısını alandan sonra müsəlman oldular. Müsəlman olandan sonra digər yarısını tələb etdilər. Borclular verməyib dedilər: "İslamda faiz haramdır. Məkkənin hakimi Əttab ibn Əsidə şikayət etdilər. O da məsələni yazıb Mədinəyə, Hz. Peyğəmbərə göndərdi. O barədə bu ayə nazil oldu. Hz. Peyğəmbər hökm verdi ki, faizin qalanını almaq haramdır. Ayənin mənası belədir:) "Ey iman gətirənlər, əgər Allah-Təalaya iman gətiribsinizsə, Allah-Təaladan qorxub, faizin qalanını tərk edib borclulardan almayın".**

**279) (فَاِنْ لَمْ تَفْعَلُوا) –** (ey Taif əhli), **əgər Allah-Təalaya itaət etməyib qalan faizi tərk etməsəniz, (فَاْذَنُوا بِحَرْبٍ مِنَ اللّٰهِ وَرَسُولِهٖ) - o zaman Allah-Təala və onun peyğəmbəri tərəfindən** (sizə qarşı) **olacaq böyük savaşdan xəbərdar olun.** (Yəni Allah-Təala qadağan edəndən sonra faiz almağınız Allah-Təala və onun peyğəmbəri ilə savaşmaq deməkdir). **(وَاِنْ تُبْتُمْ) - əgər tövbə edib faiz yeməkdən dönsəniz, (فَلَكُمْ رُؤُسُ اَمْوَالِكُمْ) - sizdən ötrü borcludan sərmayənizi almaqdan başqa, bir şey caiz deyildir. (لَا تَظْلِمُونَ) - borclu şəxslərə onlardan sərmayədən artıq almaqla zülm etməsəniz, (وَلَا تُظْلَمُونَ) - borclu şəxslər də sərmayədən əskik verməklə sizə zülm etməzlər.**

**280) (وَاِنْ كَانَ ذُو عُسْرَةٍ فَنَظِرَةٌ اِلٰى مَيْسَرَةٍۜ وَاَنْ تَصَدَّقُوا خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ تَعْلَمُونَ) - sizə borclu olan şəxs əgər yoxsul olub borcunu verə bilməsə, onun barəsində hökm budur: mal sahibi olub borcunu verə bilənə qədər, gərək, ona möhlət verilsin. Əgər o məbləğdən keçib sədəqə versəniz, sizin ondan vaz keçib bağışlamağınız daha yaxşıdır. Əgər bağışlamağın fəzilətinə agahsınızsa, əlbəttə, güzəşt edib bağışlayın.**

وَاتَّقُوا يَوْمًا تُرْجَعُونَ فِيهِ اِلَى اللّٰهِ ثُمَّ تُوَفّٰى كُلُّ نَفْسٍ مَا كَسَبَتْ وَهُمْ لَا يُظْلَمُونَ ﴿٢٨١﴾ يَآ اَيُّهَا الَّذِينَ
اٰمَنُوٓا اِذَا تَدَايَنْتُمْ بِدَيْنٍ اِلٰٓى اَجَلٍ مُسَمًّى فَاكْتُبُوهُۜ وَلْيَكْتُبْ بَيْنَكُمْ كَاتِبٌ بِالْعَدْلِۖ وَلَا يَاْبَ كَاتِبٌ اَنْ يَكْتُبَ
كَمَا عَلَّمَهُ اللّٰهُ فَلْيَكْتُبْۚ وَلْيُمْلِلِ الَّذِي عَلَيْهِ الْحَقُّ وَلْيَتَّقِ اللّٰهَ رَبَّهُ وَلَا يَبْخَسْ مِنْهُ شَيْـًٔاۜ فَاِنْ كَانَ الَّذِي عَلَيْهِ
الْحَقُّ سَفِيهًا اَوْ ضَعِيفًا اَوْ لَا يَسْتَطِيعُ اَنْ يُمِلَّ هُوَ فَلْيُمْلِلْ وَلِيُّهُ بِالْعَدْلِۜ وَاسْتَشْهِدُوا شَهِيدَيْنِ مِنْ رِجَالِكُمْۚ

---

**281) (وَاتَّقُوا يَوْمًا تُرْجَعُونَ فِيهِ اِلَى اللّٰهِ ثُمَّ تُوَفّٰى كُلُّ نَفْسٍ مَا كَسَبَتْ وَهُمْ لَا يُظْلَمُونَ) - qorxun elə bir gündən** (qiyamət günündən) **ki, o gün Allah-Təalanın tərəfinə qayıdacaqsınız, ondan sonra hər bir şəxsə dünyada qazandığı əməlin qarşılığı verilib, heç kimə zülm olunmayacaqdır.** (İbn Abbasdan rəvayət olunubdur: bu ayə peyğəmbərə nazil olan axırıncı Quran ayəsidir. Bu ayədən sonra peyğəmbər cəmi 21 gün dünyada qalıb ondan sonra dünyadan köçdü). (Gələn ayə Quranın ən uzun ayəsidir. Borc verib almaq xüsusunda nazil olubdur).

**282) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا) - ey iman gətirən şəxslər, (اِذَا تَدَايَنْتُمْ بِدَيْنٍ اِلٰٓى اَجَلٍ مُسَمًّى) – nə zaman ki müəyyən müddətə borc verib aldınız, (فَاكْتُبُوهُ) - o borcu yazıb saxlayın, yazısız borc verməyin. (وَلْيَكْتُبْ بَيْنَكُمْ كَاتِبٌ بِالْعَدْلِ) - gərək, o borcu sizin aranızda* yazan şəxs ədalət üzrə yazsın.**

*(*__Qeyd:__ Camaat arasında hər növ yazılan şeylərdən ötrü bir katibin təyin olunmasına ayə açıq-aşkar işarə edir. İslam ümməti bu ayənin məzmununa fikir verib yazmaqdan ötrü özləri üçün başqa millətlərdən qanun qəbul etməsinlər. Heyif ki, müsəlmanlar arasında cahillik geniş yayıldığından Qurani-Şərifin hökm və qanunları məxfi qalıb tərk edilibdir. İlahi, islam ümmətinin rəislərinə idrak bəxş eylə. Amin!)*

(yəni yazan şəxs gərək adil və əmin şəxs olsun, artıq və əskik yazmasın). **(وَلَا يَاْبَ كَاتِبٌ اَنْ يَكْتُبَ كَمَا عَلَّمَهُ اللّٰهُ) - hər bir yazan şəxs necə ki Allah-Təala ona öyrədib, o cür yazmaqdan çəkinib, özünü saxlamasın,** (Allah-Təalanın öyrətdiyi yol - yazarkən artıq-əskik yazmamaq, deyilən sözləri dəyişdirməmək, etibarlı yazmaqdan ibarətdir). **(فَلْيَكْتُبْ) - əlbəttə, gərək katib Allah-Təalanın qərar verdiyi kimi yazsın,** (necə ki zikr olundu), **(وَلْيُمْلِلِ الَّذِي عَلَيْهِ الْحَقُّ) – yazı vaxtı gərək üzərində haqq və borc olan şəxs də iqrar etsin,** (borclu olan şəxs gərək iqrar etsin ki, filan kəsə filan qədər borcluyam. Filankəsin filan haqqı məndədir, o zaman katib də yazsın). **(وَلْيَتَّقِ اللّٰهَ رَبَّهُ) - iqrar edən şəxs gərək öz rəbbi Allah-Təaladan qorxub, (وَلَا يَبْخَسْ مِنْهُ شَيْـًٔا) - o haqq və borcdan heç bir şeyi əskiltməsin. (فَاِنْ كَانَ الَّذِي عَلَيْهِ الْحَقُّ سَفِيهًا) - əgər üzərində haqq və borc olan şəxs səfeh olsa, (اَوْ ضَعِيفًا) – ya da zəif olsa, (qoca, ya da kiçik uşaq olsa), (اَوْ لَا يَسْتَطِيعُ اَنْ يُمِلَّ هُوَ) - ya da borclunun iqrar etməyə və yazdırmağa gücü, qüdrəti olmasa,** (məsələn, lal olsa, ya da iqrarını yaxşı bəyan edə bilməsə, o zaman onların iqrarlarının etibarı yoxdur). **(فَلْيُمْلِلْ وَلِيُّهُ بِالْعَدْلِ) - onların hər birinin vəkili onun əvəzinə gərək ədalət üzrə iqrar edib yazsın. (وَاسْتَشْهِدُوا شَهِيدَيْنِ مِنْ رِجَالِكُمْ) - yazı vaxtı kişilərinizdən iki**

فَاِنْ لَمْ يَكُونَا رَجُلَيْنِ فَرَجُلٌ وَامْرَاَتَانِ مِمَّنْ تَرْضَوْنَ مِنَ الشُّهَدَآءِ اَنْ تَضِلَّ اِحْدٰيهُمَا فَتُذَكِّرَ اِحْدٰيهُمَا الْاُخْرٰى وَلَا يَاْبَ الشُّهَدَآءُ اِذَا مَا دُعُوا وَلَا تَسْـَٔمُوٓا اَنْ تَكْتُبُوهُ صَغِيرًا اَوْ كَبِيرًا اِلٰٓى اَجَلِهِ ذٰلِكُمْ اَقْسَطُ عِنْدَ اللّٰهِ وَاَقْوَمُ لِلشَّهَادَةِ وَاَدْنٰٓى اَلَّا تَرْتَابُوٓا اِلَّا اَنْ تَكُونَ تِجَارَةً حَاضِرَةً تُدِيرُونَهَا بَيْنَكُمْ فَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَلَّا تَكْتُبُوهَا

---

**nəfər şahid tutun.** (فَاِنْ لَمْ يَكُونَا رَجُلَيْنِ) **- əgər iki nəfər kişi şahid olmasa,** (فَرَجُلٌ وَامْرَاَتَانِ) **- o vaxt gərək bir kişi və iki qadın şahid olsun.** (مِمَّنْ تَرْضَوْنَ مِنَ الشُّهَدَآءِ) **- bu şahidlər o şəxslərdən olsunlar ki, onların şahidliyinə razı olasınız,** (adil və aqil, kamil və əmin şəxsləri şahid seçin). (اَنْ تَضِلَّ اِحْدٰيهُمَا) **– şahidlikdə iki qadın bir kişinin əvəzinə təyin edildi. Hərçənd qadın elm və kamal sahibi olsa da, kişi ilə müqayisədə qüsurlu olacaqdır.** (فَتُذَكِّرَ اِحْدٰيهُمَا الْاُخْرٰى) **- O vaxtda şahidlik yadında olan qadın yadında olmayanı xatırlayaraq yadına salsın.** (Qadınların əksəriyyətində unutqanlığa görə şahidlikdə iki qadın bir kişi qərarlaşdırılmışdır. Əgər qadın elm və kamal sahibi olsa da kişinin müqabilində bu haqda naqis olacaqdır.) (وَلَا يَاْبَ الشُّهَدَآءُ اِذَا مَا دُعُوا) **– nə zaman ki şahidlər şahidlik etməyə dəvət olundular, gedib şahidlik etməkdən çəkinməyib, özlərini saxlamasınlar.** (وَلَا تَسْـَٔمُوٓا اَنْ تَكْتُبُوهُ) **- o haqqı və borcu yazmaqda sizi tənbəllik tutmasın.** (صَغِيرًا اَوْ كَبِيرًا اِلٰٓى اَجَلِهِ) **- o haqq az olsa, ya da çox olsa, onu müəyyən vaxta kimi yazıb məlum edin.** (ذٰلِكُمْ اَقْسَطُ عِنْدَ اللّٰهِ) **- sizin bu yazılan kağızınız Allah-Təala yanında ədalətdən artıq hesab olunur,** (وَاَقْوَمُ لِلشَّهَادَةِ) **- şahidin şahidliyinə kömək olub onu möhkəm edəndir,** (əlbəttə, şahidliklə birlikdə kağızın da olması haqqın sübutunda böyük dəlildir). (وَاَدْنٰٓى اَلَّا تَرْتَابُوٓا) **- o kağız* şəkk-şübhə etməyəsiniz deyə, haqqa daha yaxındır.**

*(***Qeyd:** Həqir kitab müəllifi ayənin təfsirində bu yerə çatanda yuxusuz qalan bir şəxs kimi yadına bir mətləb düşdü. Belə məsələlərdə "kağıza etibar yoxdur" deyənlər, görəsən, heç ömürlərində ölü üstündə də olsa Quran oxumayıblar? Ya da oxusalar da, lakin uydurma rəvayətlərlə əməl etdiklərindən Qurani-Şərifin açıq-aydın ayələrinə əsla diqqət etməyiblər. Qurani-Şərifdə insanlığı mədəniləşməyə çağıran belə bir hökmün olduğunu bilsələr də, çox heyif ki, uydurma rəvayətlərin müqabilində Qurani-Şərifin hökmləri etibarsız olubdur. Din və ümmətin günəşi şeyximiz əl-Bəhai Təbrəsi bu kimi fəqihlərin haqqında nə gözəl deyir: "Ayələrin əvəzinə uydurma rəvayətlərə dəvət edirlər, onları da Kə`bül-əxbardan rəvayət edərlər".*

(اِلَّا اَنْ تَكُونَ تِجَارَةً حَاضِرَةً) **- bu kağız sizə hər bir halda – alış-verişdə lazımdır,** (تُدِيرُونَهَا بَيْنَكُمْ) **- lakin öz aranızda o alış-verişi nağd etsəniz, belə alış-verişdə,** (فَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَلَّا تَكْتُبُوهَا) **– onu yazmamaqda sizə bir günah yoxdur.** (Ayədən belə məlum olur ki, alış-veriş nağd olan vaxt yenə yazılsa, yaxşıdır, amma yazılmasa da, günah olmadığını bəyan edir. Amma yazılmağın yaxşı

**وَاَشْهِدُوٓا اِذَا تَبَايَعْتُمْ ۖ وَلَا يُضَآرَّ كَاتِبٌ وَلَا شَهِيدٌ ۚ وَاِنْ تَفْعَلُوا فَاِنَّهُ فُسُوقٌ بِكُمْ ۗ وَاتَّقُوا اللّٰهَ ۗ وَيُعَلِّمُكُمُ اللّٰهُ ۗ وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿٢٨٢﴾ وَاِنْ كُنْتُمْ عَلٰى سَفَرٍ وَلَمْ تَجِدُوا كَاتِبًا فَرِهَانٌ مَقْبُوضَةٌ ۗ فَاِنْ اَمِنَ بَعْضُكُمْ بَعْضًا فَلْيُؤَدِّ الَّذِي اؤْتُمِنَ اَمَانَتَهُ وَلْيَتَّقِ اللّٰهَ رَبَّهُ ۗ وَلَا تَكْتُمُوا الشَّهَادَةَ ۗ وَمَنْ يَكْتُمْهَا فَاِنَّهُ اٰثِمٌ قَلْبُهُ ۗ وَاللّٰهُ بِمَا تَعْمَلُونَ عَلِيمٌ ﴿٢٨٣﴾**

---

olması ayədə inkar edilmir. Əlbəttə, belədir, əgər şəxs ticarət edərkən qeyd dəftərçəsi olsa, əmin bir mühasib şəxs o dəftərçəyə qeyd etsə, necə ki əksər mədəni ölkələrdə bu iş belədir, o vaxt, əlbəttə, hesabında qarışıqlıq olmaz və əgər alıb-satanlar ona qarşı haqsız bir iddia irəli sürsələr, haqq-hesab dəftəri ilə onları dəf edər. 1319 il bundan əvvəl Allah-Təala uca peyğəmbərimizin vasitəsilə hər bir alış-veriş, ticarət işində haqq-hesab və qeyd tutmağı bizdən ötrü Qurani-Şərifdə bəyan buyurubdur. Heyif olsun ki, müsəlmanlar öz qanunlarını başqalarının adına çıxıb, özlərini cahil hesab edirlər). (وَاَشْهِدُوٓا اِذَا تَبَايَعْتُمْ) **– nə zaman ki nağd, ya da nisyə alış-veriş etdiniz, şahid tutun,** (وَلَا يُضَآرَّ كَاتِبٌ وَلَا شَهِيدٌ) **- katibə və şahidə zərər verilməsin,** (yoxsa yazıda və şahidlikdə xəyanət edərlər, katibin haqqını tam verin, şahidə əgər xərclik lazım olsa, xərcliyini verin). (وَاِنْ تَفْعَلُوا فَاِنَّهُ فُسُوقٌ بِكُمْ) **- əgər katibə və şahidə zərər versəniz, həqiqətən, o verdiyiniz zərər sizin üçün bir günahdır.** (وَاتَّقُوا اللّٰهَ) **- o şeyi ki Allah-Təala sizə qadağan edibdir, Allah-Təaladan qorxub o şeyi etməyin.** (وَيُعَلِّمُكُمُ اللّٰهُ) **- Allah-Təala dünya işlərinizi sizə öyrədir,** (necə ki axirət işlərinizi də öyrədir). (وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) **- Allah-Təala bütün şeylərdən və insanlara faydalı olan məsələlərdən agahdır. Heç bir şey ona məxfi qalan deyildir.** (Ayənin təfsiri tamam oldu. Müsəlmanlar bu ayənin məzmunundan qafil olmayıb, gərək, cani-dildən onun uca məzmununa riayət etməyə çalışsınlar).

**283)** (وَاِنْ كُنْتُمْ عَلٰى سَفَرٍ) **- əgər səfərdə olub bir-birinizdən borc alsanız,** (وَلَمْ تَجِدُوا كَاتِبًا) **- səfərdə sizdən ötrü borc barəsində kağız yazan şəxs tapa bilməsəniz,** (فَرِهَانٌ مَقْبُوضَةٌ) **- yazı olmayan vaxt, gərək, haqq sahibinə bir şey girov verilsin. Ta ki ondan ötrü xatircəmlik olsun. O girovu da haqq sahibi yanında saxlasın.** (فَاِنْ اَمِنَ بَعْضُكُمْ بَعْضًا) **- əgər sizdən bəziniz digərinizdən xatircəm olub, girov almayıb borc versəniz,** (فَلْيُؤَدِّ الَّذِي اؤْتُمِنَ اَمَانَتَهُ) **- əmin hesab olunub girov verməyən o borclu şəxs, gərək, borcunu qaytarsın.** (وَلْيَتَّقِ اللّٰهَ رَبَّهُ) **- əlbəttə, borclu şəxs, gərək, öz rəbbi Allah-Təaladan qorxub haqq sahibinin haqqını inkar etməyib əskik verməsin.** (وَلَا تَكْتُمُوا الشَّهَادَةَ)**- və siz şahidlər də şahidliyinizi gizlətməyin.** (وَمَنْ يَكْتُمْهَا) **– kim şahidliyini gizlədib, şahidlik etməsə,** (فَاِنَّهُ اٰثِمٌ قَلْبُهُ) **- həqiqətən, onun qəlbi günahkardır,** (وَاللّٰهُ بِمَا تَعْمَلُونَ عَلِيمٌ) **- Allah-Təala etdiyiniz hər bir şeydən agahdır.**

لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ وَاِنْ تُبْدُوا مَا فِيٓ اَنْفُسِكُمْ اَوْ تُخْفُوهُ يُحَاسِبْكُمْ بِهِ اللّٰهُۜ فَيَغْفِرُ
لِمَنْ يَشَآءُ وَيُعَذِّبُ مَنْ يَشَآءُۜ وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٢٨٤﴾ اٰمَنَ الرَّسُولُ بِمَآ اُنْزِلَ اِلَيْهِ مِنْ رَبِّهِ
وَالْمُؤْمِنُونَۜ كُلٌّ اٰمَنَ بِاللّٰهِ وَمَلٰٓئِكَتِهِ وَكُتُبِهِ وَرُسُلِهِۜ لَا نُفَرِّقُ بَيْنَ اَحَدٍ مِنْ رُسُلِهِۜ وَقَالُوا سَمِعْنَا وَاَطَعْنَا
غُفْرَانَكَ رَبَّنَا وَاِلَيْكَ الْمَصِيرُ ﴿٢٨٥﴾ لَا يُكَلِّفُ اللّٰهُ نَفْسًا اِلَّا وُسْعَهَاۜ لَهَا مَا كَسَبَتْ وَعَلَيْهَا مَا اكْتَسَبَتْۜ
رَبَّنَا لَا تُؤَاخِذْنَآ اِنْ نَسِينَآ اَوْ اَخْطَاْنَاۚ رَبَّنَا وَلَا تَحْمِلْ عَلَيْنَآ اِصْرًا كَمَا حَمَلْتَهُ عَلَى الَّذِينَ مِنْ قَبْلِنَاۚ

---

**284) (لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ) - səmalarda və yerdə olan bütün şeylərin səltənəti Allah-Təalaya məxsusdur. (وَاِنْ تُبْدُوا مَا فِيٓ اَنْفُسِكُمْ اَوْ تُخْفُوهُ) - qəlbinizdə hər hansı bir günaha niyyət etsəniz, əgər qəlbinizdə olan günahı ortaya çıxarıb etsəniz, ya da gizlədb zahir etməsəniz, elə ki qəlbən o günahı etməyə niyyət etdiniz, (يُحَاسِبْكُمْ بِهِ اللّٰهُ) - o qəlbinizdə olan günahdan ötrü Allah-Təala sizinlə haqq-hesab çəkib intiqam alacaqdır. (فَيَغْفِرُ لِمَنْ يَشَآءُ) - Allah-Təala kimin bağışlanmasını istəsə, onu bağışlayar, (tövbə edən şəxsi bağışlayar, amma tövbə etməyən şəxsin bağışlanmasını Allah-Təala istəməz). (وَيُعَذِّبُ مَنْ يَشَآءُ) - Allah-Təala kimə əzab istəsə, ona əzab edər,** (tövbə etməyənlərə əzab edər). **(وَاللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ قَدِيرٌ) - Allah-Təala bağışlayıb əzab etməyə, hər bir şeyə qadirdir.**

**285) (اٰمَنَ الرَّسُولُ بِمَآ اُنْزِلَ اِلَيْهِ مِنْ رَبِّهِ) –peyğəmbərə öz rəbbi Allah-Təala tərəfindən nə ki nazil olubdur, peyğəmbər ona iman gətiribdir. (وَالْمُؤْمِنُونَ كُلٌّ اٰمَنَ بِاللّٰهِ) - möminlər də bütünlüklə Allah-Təalaya iman gətiribdirlər, (وَمَلٰٓئِكَتِهِ وَكُتُبِهِ وَرُسُلِهِ) - Onun mələklərinə, kitablarına və peyğəmbərlərinə də iman gətiriblər. (لَا نُفَرِّقُ بَيْنَ اَحَدٍ مِنْ رُسُلِهِ) - möminlər deyirlər: "İman gətirməkdə Allah-Təala peyğəmbərlərinin arasında fərq qoymarıq". (وَقَالُوا سَمِعْنَا وَاَطَعْنَا) - möminlər dedilər: "İlahi, Qurani-Şərifdə nazil etdiyin əmrlərini eşidib itaət etdik, (غُفْرَانَكَ رَبَّنَا) - bağışlanmaq istəyirik səndən, ey bizim rəbbimiz). (وَاِلَيْكَ الْمَصِيرُ) – axır qiyamət günündə dönüşümüz Sənədir".**

**286) (لَا يُكَلِّفُ اللّٰهُ نَفْسًا) - Allah-Təala heç bir kimə yükləməz, (اِلَّا وُسْعَهَا) - ancaq o şəxsin gücü-taqəti qədər** (yükləyər), **(لَهَا مَا كَسَبَتْ) - hər kəsin qazandığı xeyir əməlin mənfəəti özünə aiddir, (وَعَلَيْهَا مَا اكْتَسَبَتْ) - hər kəsin qazandığı şər əməlin cəzası və zərəri özünə aiddir. Heç kimin əməlindən başqasına xeyir və zərər aid olmaz.** (Bundan sonra Allah-Təala öz bəndələrinə dua məqamında necə dua edilməlidir, onu göstərir). **(رَبَّنَا لَا تُؤَاخِذْنَآ)** – (ey mənim bəndələrim, dua məqamında belə dua edin:) **"Ey bizim rəbbimiz, cəzalandırma bizi, (اِنْ نَسِينَآ اَوْ اَخْطَاْنَا) - əgər sənin bəzi ehkamını yadımızdan çıxarıb, ya da xəta edib sənə asi olsaq, (رَبَّنَا وَلَا تَحْمِلْ عَلَيْنَآ اِصْرًا) - ey bizim rəbbimiz, ağır olan yüklə bizi yükləmə, (كَمَا حَمَلْتَهُ عَلَى الَّذِينَ مِنْ قَبْلِنَا) - necə ki bizdən əvvəl keçənlərə** (bəni-İsrailə) **ağır yüklər yükləyibsən.**

رَبَّنَا وَلَا تُحَمِّلْنَا مَا لَا طَاقَةَ لَنَا بِهٖۚ وَاعْفُ عَنَّاۜ وَاغْفِرْ لَنَاۜ وَارْحَمْنَاۜ اَنْتَ مَوْلٰينَا فَانْصُرْنَا عَلَى الْقَوْمِ الْكَافِرِينَ﴿٢٨٦﴾

---

**(رَبَّنَا وَلَا تُحَمِّلْنَا مَا لَا طَاقَةَ لَنَا بِهٖ) - ey bizim rəbbimiz, o əzab ki bizim ona taqətimiz yoxdur, onu bizə göndərib yükləmə. (وَاعْفُ عَنَّاۜ وَاغْفِرْ لَنَاۜ) - əfv edib günahlarımızı bağışla, (وَارْحَمْنَاۜ) - rəhm edib** (bizə əzabdan nicat ver)**, (اَنْتَ مَوْلٰينَا) - sənsən bizim ağamız,** (bizik sənin qulamların)**. (فَانْصُرْنَا عَلَى الْقَوْمِ الْكَافِرِينَ) - bizə kömək olub, kafir olan camaata bizi qalib et".**

(Həmd olsun Allahın yardımı ilə bu mübarək surənin təfsiri tamam oldu. "Bu surənin fəziləti haqqında Hz. Peyğəmbər buyurub: Bəqərə surəsini öyrənin, həqiqətən, bu surənin öyrənilməsində bərəkət, tərk edilməsində də təəssüf və peşmançılıq vardır").

## ALİ-İMRAN SURƏSİ

3-cü surədir. Mədinədə nazil olub, 200 ayə, 3470 kəlmə və 14520 hərfdir.

بِسْمِ اللهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الٓمٓ ﴿١﴾ اَللهُ لَا اِلٰهَ اِلَّا هُوَ الْحَيُّ الْقَيُّومُ ﴿٢﴾ نَزَّلَ عَلَيْكَ الْكِتَابَ
بِالْحَقِّ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ وَاَنْزَلَ التَّوْرٰيةَ وَالْاِنْجِيلَ ﴿٣﴾ مِنْ قَبْلُ هُدًى لِلنَّاسِ وَاَنْزَلَ الْفُرْقَانَ اِنَّ
الَّذِينَ كَفَرُوا بِاٰيَاتِ اللهِ لَهُمْ عَذَابٌ شَدِيدٌ وَاللهُ عَزِيزٌ ذُو انْتِقَامٍ ﴿٤﴾ اِنَّ اللهَ لَا يَخْفٰى عَلَيْهِ شَيْءٌ
فِي الْاَرْضِ وَلَا فِي السَّمَاۤءِ ﴿٥﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (الٓمٓ) - yəni bu mübarək surənin adı Əlif Ləm Mimdir. Bu surə Əlif Ləm Mim surəsidir.**

**2) (اَللهُ لَا اِلٰهَ اِلَّا هُوَ الْحَيُّ الْقَيُّومُ) - haqq olan məbud Allah-Təaladır. Ondan başqa, haqq olan məbud yoxdur. Heç vaxt Onun müqəddəs Zatına yoxluq yol tapmayıb, insanların bütün işlərini idarə edən müqəddəs Zatıyla əbədidir.**

**3) (نَزَّلَ عَلَيْكَ الْكِتَابَ بِالْحَقِّ)*** – (ey Məhəmməd), **Allah-Təala bu Quranı haqq olaraq bir neçə il ərzində sənə nazil etdi,** (musaddiqən lima beynə yədeyhi) **(مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ)– özündən əvvəl nazil olan kitabları təsdiq edən bir halda, (وَاَنْزَلَ التَّوْرٰيةَ وَالْاِنْجِيلَ مِنْ قَبْلُ هُدًى لِلنَّاسِ) - Allah-Təala bundan əvvəl xalqı haqqa hidayət etməkdən ötrü Tövrat və İncili bir dəfəyə nazil etdi. (وَاَنْزَلَ الْفُرْقَانَ) - Allah-Təala bu kitabları haqla batil arasında fərq qoymaq üçün nazil etdi.**

*(***Qeyd:** "nəzələ"nin mənası tədricən nazil etməkdir. "ənzələ"nin mənası bir dəfəyə nazil etməkdir. Çünki Qurani-Şərif 23 il ərzində nazil olubdur. O səbəbdən "nəzələ" buyurdu. Tövrat və İncil isə bir dəfəyə nazil olduğundan "ənzələ" buyurdu).*

**(اِنَّ الَّذِينَ كَفَرُوا بِاٰيَاتِ اللهِ) - həqiqətən, o şəxslər ki Allah-Təalanın kitablarında olan ayə və ehkamları inkar edib, (لَهُمْ عَذَابٌ شَدِيدٌ) - onlardan ötrü axirətdə şiddətli əzab vardır. (وَاللهُ عَزِيزٌ ذُو انْتِقَامٍ) - Allah-Təala məxluqata qalib olub onlardan intiqam alandır.**

**5) (اِنَّ اللهَ لَا يَخْفٰى عَلَيْهِ شَيْءٌ فِي الْاَرْضِ وَلَا فِي السَّمَاۤءِ) - həqiqətən, Allah-Təala elə bir alim və müqəddəs Zatdır ki, nə yerdə və nə də səmada heç bir şey ona məxfi qalmaz.**

هُوَ الَّذٖي يُصَوِّرُكُمْ فِي الْاَرْحَامِ كَيْفَ يَشَٓاءُۜ لَٓا اِلٰهَ اِلَّا هُوَ الْعَزٖيزُ الْحَكٖيمُ ﴿٦﴾ هُوَ الَّذٖي اَنْزَلَ عَلَيْكَ الْكِتَابَ مِنْهُ اٰيَاتٌ مُحْكَمَاتٌ هُنَّ اُمُّ الْكِتَابِ وَاُخَرُ مُتَشَابِهَاتٌۜ فَاَمَّا الَّذٖينَ فٖي قُلُوبِهِمْ زَيْغٌ فَيَتَّبِعُونَ مَا تَشَابَهَ مِنْهُ ابْتِغَٓاءَ الْفِتْنَةِ وَابْتِغَٓاءَ تَاْوٖيلِهٖۚ وَمَا يَعْلَمُ تَاْوٖيلَهُ اِلَّا اللّٰهُۢ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ يَقُولُونَ اٰمَنَّا بِهٖۙ كُلٌّ مِنْ عِنْدِ رَبِّنَاۚ

---

**6) (هُوَ الَّذٖي يُصَوِّرُكُمْ فِي الْاَرْحَامِ) - o elə bir Allah-Təaladır ki, sizi anaların rəhmlərində bir surətə daxil edər, (كَيْفَ يَشَٓاءُ) – istədiyi kimi müxtəlif və fərqli surətlərə** (salar). **(لَٓا اِلٰهَ اِلَّا هُوَ الْعَزٖيزُ الْحَكٖيمُ) - yoxdur Ondan başqa haqq olan məbud, məxluqata qalib olub hikmət üzrə məxluqatı fərqli-fərqli yaradan Odur.**

**7) (هُوَ الَّذٖي اَنْزَلَ عَلَيْكَ الْكِتَابَ) -** (ey Məhəmməd), **O, qadir və əzəmətli olan elə bir Allah-Təaladır ki, sənə bu Quranı nazil edibdir. (مِنْهُ اٰيَاتٌ مُحْكَمَاتٌ) - Quranın bəzi ayələri vardır ki, onların öz mənalarına işarəsi açıq-aşkardır. Heç bir başqa mənası yoxdur.** (Bunlar ehkam ayələridir). **(هُنَّ اُمُّ الْكِتَابِ) - o ayələr Quranın anası və əslidir ki, onlarda əsla bir şübhə yoxdur. (وَاُخَرُ مُتَشَابِهَاتٌ) - o möhkəm ayələrdən başqa.** (Qurani-Şərifdə bəzi ayələr vardır ki, onların mənası mütəşabihdir (məcazidir). Başqa mənaları da vardır. Məsələn, bu ayələr kimi: الرَّحْمَنُ عَلَى الْعَرْشِ اسْتَوَى (Taha, 20/5); وُجُوهٌ يَوْمَئِذٍ نَّاضِرَةٌ إِلَى رَبِّهَا نَاظِرَةٌ (Qiyamət, 75/22-23); وَجَاء رَبُّكَ وَالْمَلَكُ صَفًّا صَفًّا (Fəcr, 89/22); və s. bunlardan başqa, bəzi ayələr də var ki, hər biri öz yerində qeyd olunacaqdır. Bu ayələrin zahiri Allah-Təalanın cism olmasına işarə edər, alim şəxs isə bu ayələrin həqiqi mənasını anlayıb, Allah-Təalanın cism olmasına işarə etmədiyini bəyan edər. Amma alim olmayan şəxs nəfsani arzulara tabe olub, ayələrə öz istədiyi kimi məna verib: "Kim Quranı öz şəxsi görüşünə görə təfsir edərsə, kafir olar," (Əhməd b. Hənbəl, Müsnəd, I/269; Tirmizi, Təfsirul-Quran, 1)- hədisinin ehtivasına daxil olar, necə ki buyurur:) **(فَاَمَّا الَّذٖينَ فٖي قُلُوبِهِمْ زَيْغٌ) - amma o şəxslər** (islamda bidət yaradan şəxslər) **ki, onların qəlblərində haqdan batilə meyil etmək vardır, (فَيَتَّبِعُونَ مَا تَشَابَهَ مِنْهُ) - belə şəxslər Quranın ayələrindən mütəşabih, başqa mənaları olan ayələrə tabe olub özlərindən ötrü dəlil edərlər.** (Necə ki keçən ayələrdə qeyd olundu). **(ابْتِغَٓاءَ الْفِتْنَةِ) - fitnə salıb, xalqı dindən kənar edib zəlalətə salmaqdan ötrü mütəşabih ayələrə tabe olarlar. (وَابْتِغَٓاءَ تَاْوٖيلِهٖ) - yenə o ayələri öz istəklərinə müvafiq yozmaqdan ötrü o ayələrə tabe olarlar.* (وَمَا يَعْلَمُ تَاْوٖيلَهُ اِلَّا اللّٰهُ وَالرَّاسِخُونَ فِي الْعِلْمِ) - o mütəşabih ayələrin haqq olan yozumunu ancaq Allah-Təala, bir də elmdə qüvvətli olanlardan başqası bilməz, (يَقُولُونَ اٰمَنَّا بِهٖ) - elmdə qüvvətli və mütəşabih ayələrin yozumuna agah olanlar deyərlər: "O mütəşabih olan ayələrə iman gətirmişik. (كُلٌّ مِنْ عِنْدِ رَبِّنَا) – möhkəm və mütəşabihin hər biri rəbbimiz Allah-Təala tərəfindən nazil olubdur".** (Allah-Təala elmdə qüvvətli olanları vəsf edib

وَمَا يَذَّكَّرُ اِلَّا اُولُوا الْاَلْبَابِ ﴿٧﴾ رَبَّنَا لَا تُزِغْ قُلُوبَنَا بَعْدَ اِذْ هَدَيْتَنَا وَهَبْ لَنَا مِنْ لَدُنْكَ رَحْمَةً اِنَّكَ
اَنْتَ الْوَهَّابُ ﴿٨﴾ رَبَّنَا اِنَّكَ جَامِعُ النَّاسِ لِيَوْمٍ لَا رَيْبَ فِيهِ اِنَّ اللّٰهَ لَا يُخْلِفُ الْمِيعَادَ ﴿٩﴾ اِنَّ الَّذِينَ
كَفَرُوا لَنْ تُغْنِيَ عَنْهُمْ اَمْوَالُهُمْ وَلَا اَوْلَادُهُمْ مِنَ اللّٰهِ شَيْـًٔا وَاُولٰٓئِكَ هُمْ وَقُودُ النَّارِ ﴿١٠﴾ كَدَاْبِ اٰلِ
فِرْعَوْنَ وَالَّذِينَ مِنْ قَبْلِهِمْ كَذَّبُوا بِاٰيَاتِنَا فَاَخَذَهُمُ اللّٰهُ بِذُنُوبِهِمْ وَاللّٰهُ شَدِيدُ الْعِقَابِ ﴿١١﴾ قُلْ لِلَّذِينَ
كَفَرُوا سَتُغْلَبُونَ وَتُحْشَرُونَ اِلٰى جَهَنَّمَ

---

buyurur:) (وَمَا يَذَّكَّرُ اِلَّا اُولُوا الْاَلْبَابِ) - **"Mütəşabih ayələrin mənasını kamil ağıla və qüvvətli elmə sahib olanlardan başqası anlamaz".**

*(*Qeyd: Quranı oxuyarkən "fil-elm"də durmaq lazımdır).*

**8) (رَبَّنَا لَا تُزِغْ قُلُوبَنَا بَعْدَ اِذْ هَدَيْتَنَا) -** (elmdə qüvvətli olanlar dua məqamında belə deyərlər:) **"Ey bizim rəbbimiz, bizə hidayət edib din və iman tərəfinə irşad edəndən sonra bizim qəlblərimizi haqq və hidayətdən batil tərəfinə əymə, (وَهَبْ لَنَا مِنْ لَدُنْكَ رَحْمَةً) - öz yanından bizə bir rəhmət bəxşiş et ki, o rəhmətin səbəbinə müvəffəq olub, din və imanda sabit olaq, (اِنَّكَ اَنْتَ الْوَهَّابُ) - həqiqətən, əvəzsiz və qərəzsiz bəxş verən, bəxş edən sənsən".**

**9) (رَبَّنَا اِنَّكَ جَامِعُ النَّاسِ لِيَوْمٍ لَا رَيْبَ فِيهِ اِنَّ اللّٰهَ لَا يُخْلِفُ الْمِيعَادَ) -** (yenə deyərlər:) **"Ey bizim rəbbimiz, həqiqətən, sənsən bütün insanları elə bir günün** (qiyamət günü) **hesab və cəzasından ötrü toplayan ki, o günün vaqe olacağına heç bir şəkk və şübhə yoxdur. (Allah-Təala buyurur: "Mənim bəndələrim belə deyər:) həqiqətən, Allah-Təala öz vədinə xilaf çıxmayıb, qiyamət gününü vəd etdiyi kimi vaqe edəcəkdir".**

**10) (اِنَّ الَّذِينَ كَفَرُوا) –** (ey Məhəmməd)**, həqiqətən, kafir olan şəxslərin, (لَنْ تُغْنِيَ عَنْهُمْ اَمْوَالُهُمْ وَلَا اَوْلَادُهُمْ مِنَ اللّٰهِ شَيْـًٔا) - nə malları, nə övladları onları Allah-Təaladan ehtiyacsız etməz, həmişə Allah-Təalaya ehtiyacları vardır, (وَاُولٰٓئِكَ هُمْ وَقُودُ النَّارِ) - əlbəttə, onlar cəhənnəm odunun yanacağıdırlar.**

**11) (كَدَاْبِ اٰلِ فِرْعَوْنَ) –** (ey Məhəmməd)**, səni inkar edənlərin dəb və adətləri firon əhlinin dəb və adətləri kimidir, (Necə ki onlar Musanı təkzib etdilər, habelə bu kafirlər də səni təkzib etdilər), (وَالَّذِينَ مِنْ قَبْلِهِمْ) - yenə o şəxslərin dəb və adətləri kimidir ki, firondan əvvəl olublar, (كَذَّبُوا بِاٰيَاتِنَا) – onlar bizim ayələrimizi təkzib etdilər. (فَاَخَذَهُمُ اللّٰهُ بِذُنُوبِهِمْ) - Allah-Təala da onları öz günahlarının səbəbinə əzab etməkdən ötrü tutdu. (وَاللّٰهُ شَدِيدُ الْعِقَابِ) -Allah-Təala onun ayə və ehkamlarını təkzib edənlərə şiddətli əzab edəndir.**

**12) (قُلْ لِلَّذِينَ كَفَرُوا) –** (ey Məhəmməd)**, kafir olan yəhudilərə de ki, (سَتُغْلَبُونَ) –** (ey yəhudi camaatı)**, əgər bizimlə savaşsanız, əlbəttə məğlub olarsınız.** (Necə ki bütün yəhudilər müsəlmanların əlində məğlub oldular, bu, peyğəmbərimizin doğruluğuna bir dəlildir). **(وَتُحْشَرُونَ اِلٰى جَهَنَّمَ) - qiyamət gü-**

وَبِئْسَ الْمِهَادُ ﴿١٢﴾ قَدْ كَانَ لَكُمْ اٰيَةٌ فٖي فِئَتَيْنِ الْتَقَتَاۜ فِئَةٌ تُقَاتِلُ فٖي سَبٖيلِ اللّٰهِ وَاُخْرٰى كَافِرَةٌ يَرَوْنَهُمْ مِثْلَيْهِمْ رَاْيَ الْعَيْنِۜ وَاللّٰهُ يُؤَيِّدُ بِنَصْرِهٖ مَنْ يَشَٓاءُۜ اِنَّ فٖي ذٰلِكَ لَعِبْرَةً لِاُو۬لِي الْاَبْصَارِ ﴿١٣﴾ زُيِّنَ لِلنَّاسِ حُبُّ الشَّهَوَاتِ

---

**nündə də cəhənnəmə tərəf toplanarsınız.** (Yəni sizi cəhənnəmə apararlar). **(وَبِئْسَ الْمِهَادُ) - kafirlərdən ötrü cəhənnəm nə pis döşənmiş bir məkandır.** (Allah-Təala sıradakı ayədə buna işarə edir ki, ey yəhudi camaatı, onsuz da müsəlmanların əlində məğlub olacaqsınız, gəlin Qurana iman gətirin, sizin məğlub olacağınız haqqında böyük bir əlamət var, o əlamət budur ki, məkkəli Qüreyş camaatı sizdən sayca çox və qüvvətli olsalar da, baxıb görün müsəlmanların əlində necə məğlub oldular, bəs siz yəhudilər bundan ibrət götürmürsünüz?)

**13) (قَدْ كَانَ لَكُمْ اٰيَةٌ) –** (ey yəhudilər)**, həqiqətən, sizdən ötrü islamın haqq olduğuna bir əlamət var idi. O əlamət sizdən ötrü islamın haqq olmasına böyük dəlildir. Bəs niyə o dəlilə baxıb iman gətirmirsiniz? (فٖي فِئَتَيْنِ الْتَقَتَاۜ) - o əlamət iki tayfanın bir-biri ilə qarşılaşıb** (Bədirdə) **savaşmasında idi. (فِئَةٌ تُقَاتِلُ فٖي سَبٖيلِ اللّٰهِ) - bir tayfa** (peyğəmbər və səhabələri) **savaşırdı Allah-Təala yolunda,** (o savaşda islam ordusu 313 nəfərdən ibarət idi). **(وَاُخْرٰى كَافِرَةٌ) - o biri tərəf kafirlər idi.** (Məkkəli müşriklərin sayı Bədir savaşında 950 nəfər idi. İnşallah Bədir savaşının əhvalatı Ənfal surəsində təfsilatı ilə qeyd olunacaqdır.) **Nə zaman ki iki ordu qarşılaşdı, (يَرَوْنَهُمْ مِثْلَيْهِمْ) - müşriklər müsəlmanları özlərindən ikiqat artıq gördülər, halbuki müşriklər müsəlmanlardan üçqat çox idilər, (رَاْيَ الْعَيْنِۜ) - müşriklərin bu görməsi aşkar gözlə görmək idi ki, əsla onda şübhə yox idi, necə ki başqa şeyləri görürdülər.** (Allah-Təala Bədir savaşında əvvəlcə müsəlmanları müşriklərin gözünə olduğundan az göstərdi ki, savaşmağa cəsarət etsinlər, elə ki savaşa başladılar, müsəlmanları müşriklərin gözündə özlərindən ikiqat artıq göstərib onların qəlbinə qorxu saldı və məğlub etdi. Ey yəhudi camaatı, müşriklərin məğlub olmağını siz açıq-aşkar gördünüz, bəs bu, sizdən ötrü islamın haqq olmasına bir əlamət deyilmi?) **(وَاللّٰهُ يُؤَيِّدُ بِنَصْرِهٖ مَنْ يَشَٓاءُ) - Allah-Təala öz yardımı ilə kimə istəsə, qüvvət verib qalib edər. (اِنَّ فٖي ذٰلِكَ لَعِبْرَةً لِاُو۬لِي الْاَبْصَارِ) - həqiqətən, bu Bədir əhvalatında ağıl sahibləri üçün böyük ibrət vardır.** (Sayca az və qüvvətsiz bir camaat güclü və sayca çox olan camaatı necə dağıtdı? Bu, ancaq Allah-Təalanın istəyi ilə olmadımı?)

**14) (زُيِّنَ لِلنَّاسِ حُبُّ الشَّهَوَاتِ) -** ("nəfsi-əmmarə") **insanlara istədikləri şeyləri gözəl göstərib,** (insanlar o şeylərə məşğul oldular Allah-Təaladan birdəfəlik kənarlaşdılar, olub itaət etməyib Ona şərik qoşdular. Halbuki gərək Allah-Təalaya şükür edəydilər, çünki onların arzu etdiyi şeylərin xa-

مِنَ النِّسَآءِ وَالْبَنِينَ وَالْقَنَاطِيرِ الْمُقَنْطَرَةِ مِنَ الذَّهَبِ وَالْفِضَّةِ وَالْخَيْلِ الْمُسَوَّمَةِ وَالْاَنْعَامِ
وَالْحَرْثِ ذٰلِكَ مَتَاعُ الْحَيٰوةِ الدُّنْيَاۚ وَاللّٰهُ عِنْدَهُ حُسْنُ الْمَاٰبِ ﴿١٤﴾ قُلْ اَؤُنَبِّئُكُمْ بِخَيْرٍ
مِنْ ذٰلِكُمْ ۜ لِلَّذِينَ اتَّقَوْا عِنْدَ رَبِّهِمْ جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَا وَاَزْوَاجٌ
مُطَهَّرَةٌ وَرِضْوَانٌ مِنَ اللّٰهِ وَاللّٰهُ بَصِيرٌ بِالْعِبَادِۚ ﴿١٥﴾ اَلَّذِينَ يَقُولُونَ رَبَّنَآ اِنَّنَآ اٰمَنَّا فَاغْفِرْ لَنَا
ذُنُوبَنَا وَقِنَا عَذَابَ النَّارِۚ ﴿١٦﴾

---

liqi Allah-Təaladır). **İnsanların istədiyi şeylər: (مِنَ النِّسَآءِ) - yaxşı, gözəl qadınlardan, (وَالْبَنِينَ) - və oğlanlardan, (وَالْقَنَاطِيرِ الْمُقَنْطَرَةِ) - və çox olan mallar, (مِنَ الذَّهَبِ وَالْفِضَّةِ) - qızıldan və gümüşdən, (وَالْخَيْلِ الْمُسَوَّمَةِ) - və işarətlənmiş cins atlardan, (وَالْاَنْعَامِ) - dəvə, qoyun, keçi, öküzdən, (وَالْحَرْثِ) - və hər növ əkin yerindən ibarətdir, (bütün bu qeyd olunan şeyləri Allah-Təala insanlardan ötrü yaradıbdır, necə ola bilər ki, insanlar Allah-Təalanın bu nemətləri ilə bir-birilərinə qarşı öyünsünlər, amma aləmlərin xaliqini yaddan çıxarıb ona şərik qoşsunlar? Bəs bu, Allah-Təalaya qarşı böyük zülm deyilmi?) (ذٰلِكَ مَتَاعُ الْحَيٰوةِ الدُّنْيَاۚ) - bu qeyd olunan şeylər dünya həyatının müvəqqəti nemətləridir. Əgər onlar olmasa, dünyada yaşamaq mümkün olmaz. Necə ki sizdən ötrü Allah-Təala bu şeyləri dünyada yaradıbdır, bunlardan da artıq axirətdə yaradıbdır. (وَاللّٰهُ عِنْدَهُ حُسْنُ الْمَاٰبِ) - dünyadan daha gözəl yurd və məkan axirətdə Allah-Təalanın yanındadır.** (Bəs niyə Allah-Təaladan kənar olursunuz, dünyada məişət səbəblərini sizə göstərdiyi kimi, axirətdə ondan da artığını sizdən ötrü hazır edibdir).

**15) (قُلْ اَؤُنَبِّئُكُمْ بِخَيْرٍ مِنْ ذٰلِكُمْ)** – (ey Məhəmməd), **xalqa de ki, istəyirsinizsə, bu dünya mənfəətindən yaxşı olan şeyləri sizə xəbər verim, (لِلَّذِينَ اتَّقَوْا عِنْدَ رَبِّهِمْ) - təqva əhlindən ötrü öz rəbləri Allah-Təala yanında, (جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ) - ağaclarının və qəsrlərinin altından çaylar axan bağlar vardır, (خَالِدِينَ فِيهَا) - həmişəlik o bağlarda qalıb çıxmazlar və burada yalnız olmazlar. Çünki insanın təbiəti yalnız qalmağa uyğun deyildir. (وَاَزْوَاجٌ مُطَهَّرَةٌ) – və onlardan ötrü cənnətdə dünya qadınlarında olan hər bir eyib və xəbislikdən pak olan qadınlar vardır. (وَرِضْوَانٌ مِنَ اللّٰهِ)** - (Yenə axirətdə müttəqilərə bunlardan da artıq nemətlər Allah-Təala tərəfindən razılıqla elan olunacaqdır. Onun məmnunluğu bütün nemətlərdən üstündür). **(وَاللّٰهُ بَصِيرٌ بِالْعِبَادِ)- Allah-Təala öz bəndələrinin əhvalına agahdır.**

**16) (اَلَّذِينَ يَقُولُونَ رَبَّنَآ اِنَّنَآ اٰمَنَّا فَاغْفِرْ لَنَا ذُنُوبَنَا وَقِنَا عَذَابَ النَّارِ) - təqva əhli o şəxslərdir ki, dua məqamında deyərlər: "Ey bizim rəbbimiz! Həqiqətən, biz sənə iman gətirmişik, bizim günahlarımızı bağışlayıb cəhənnəm odundan bizi qoru".**

اَلصَّابِرِينَ وَالصَّادِقِينَ وَالْقَانِتِينَ وَالْمُنْفِقِينَ وَالْمُسْتَغْفِرِينَ بِالْاَسْحَارِ ﴿١٧﴾ شَهِدَ اللّٰهُ اَنَّهُ لَٓا اِلٰهَ
اِلَّا هُوَۙ وَالْمَلٰٓئِكَةُ وَاُولُوا الْعِلْمِ قَٓائِمًا بِالْقِسْطِۜ لَٓا اِلٰهَ اِلَّا هُوَ الْعَزِيزُ الْحَكِيمُۜ ﴿١٨﴾ اِنَّ الدِّينَ
عِنْدَ اللّٰهِ الْاِسْلَامُ۠ وَمَا اخْتَلَفَ الَّذِينَ اُو۫تُوا الْكِتَابَ اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَهُمُ الْعِلْمُ بَغْيًا بَيْنَهُمْۜ

---

**17) (اَلصَّابِرِينَ) - təqva əhli vacibləri yerinə yetirib, haramları tərk edib hər bir bəla və günah məqamında səbir edəndir. (وَالصَّادِقِينَ) - islama iman gətirməkdə sadiqdir. (وَالْقَانِتِينَ) - Allah-Təalanın əmr və qadağalarına itaət edib Ona ibadət edəndir. (وَالْمُنْفِقِينَ) - Allah-Təala yolunda sədəqə və ehsan verəndir. (وَالْمُسْتَغْفِرِينَ بِالْاَسْحَارِ) - sübhdən əvvəl gecə namazını qılıb Allah-Təaladan bağışlanmaq istəyənlərdir.**

**18) (شَهِدَ اللّٰهُ) - Allah-Təala şahidlik edir ki, (اَنَّهُ لَٓا اِلٰهَ اِلَّا هُوَ) - həqiqətən, Allah-Təaladan başqa, heç bir haqq olan məbud yoxdur. (وَالْمَلٰٓئِكَةُ وَاُولُوا الْعِلْمِ) -mələklər və elm əhli də buna şahidlik edərlər. (قَٓائِمًا بِالْقِسْطِ) - Allah-Təala öz müqəddəs Zatıyla xalqın işlərini ədalət* üzrə idarə etdiyi halda, bu şahidliyi edir. (لَٓا اِلٰهَ اِلَّا هُوَ الْعَزِيزُ الْحَكِيمُ) - məxluqata qalib olub hikmət sahibi olan Allah-Təaladan başqa, heç bir haqq olan məbud yoxdur.**

*(*Qeyd: Ədalət uca xüsusiyyətlərdən biridir. Allah-Təala insanı öz surətinə uyğun yaratdığı üçün insan gərək Allah-Təalanın sifətləri ilə, xüsusən, ədalət sifəti ilə bəzənsin. Bu xüsusiyyətə sahib olan millət onun ziddi olan zülm sifətindən uzaq olar. Çünki ağılın hökmü ilə iki zidd şeyin bir yerdə var olması imkansızdır. Bədbəxt isə o millətdir ki, ədalət sifəti onların içində olmayıb, əksinə zülm sifəti yayılmış olsun. Belə millətin nicat tapması mümkün deyildir. Demək olar ki, bu dövrdə xəbis zülm sifəti islam ümməti arasında yayğın olub, onun ziddi olan ədalət sifəti qeyb olubdur. Bəli, Qurani-Şərifin hökmləri gizli və məxfi qalanda belə olur).*

**19) (اِنَّ الدِّينَ عِنْدَ اللّٰهِ الْاِسْلَامُ) - həqiqətən, haqq olan din Allah-Təala yanında islamdır.** (İslam dini Allah-Təalanın tövhid və ədalətinə tabe olub, Hz. Məhəmməd peyğəmbərə iman gətirməkdən ibarətdir). **(وَمَا اخْتَلَفَ الَّذِينَ اُوتُوا الْكِتَابَ) - Yəhudi və Xristian kitab verilənlər dini-İslama müxalif olmadılar. (اِلَّا مِنْ بَعْدِ مَا جَٓاءَهُمُ الْعِلْمُ) - Ancaq Allah-Təala tərəfindən islamın haqq olması haqqında onlara elm gələndən sonra,** (elm - Tövratda islamın haqq olması haqqında verilən xəbərdir), **onlar elm sahibi olduqları üçün gərək islam haqqında ixtilaf etməyəydilər.(بَغْيًا بَيْنَهُمْ) – islam haqda ixtilaf etmələri ancaq öz aralarında olan həsəddən ötrüdür ki, niyə peyğəmbər ərəblərdən olsun? Və bir də hakimiyyətə görədir, çünki əgər islama daxil olsaydılar, onlardan ötrü hakimiyyət mümkün olmazdı.** (Bu mətləb üləmaya aiddir, bəli, fəsad əvvəlcə üləmadan meydana gələr. Uca peyğəmbərimiz buyurubdur: "Nə zaman ki alim fəsad törətdi, bütün aləm fəsad edər" (Buxari, Elm 34; Müslüm,Elm 13; Tirmizi, Elm 5). Peyğəmbər necə də doğru deyib. İslam ümmətinin bir neçə

وَمَنْ يَكْفُرْ بِاٰيَاتِ اللّٰهِ فَاِنَّ اللّٰهَ سَرِيعُ الْحِسَابِ ﴿١٩﴾ فَاِنْ حَآجُّوكَ فَقُلْ اَسْلَمْتُ وَجْهِيَ لِلّٰهِ وَمَنِ
اتَّبَعَنِ وَقُلْ لِلَّذِينَ اُوتُوا الْكِتَابَ وَالْاُمِّيِّنَ ءَاَسْلَمْتُمْ فَاِنْ اَسْلَمُوا فَقَدِ اهْتَدَوْا وَاِنْ تَوَلَّوْا فَاِنَّمَا
عَلَيْكَ الْبَلَاغُ وَاللّٰهُ بَصِيرٌ بِالْعِبَادِ ﴿٢٠﴾ اِنَّ الَّذِينَ يَكْفُرُونَ بِاٰيَاتِ اللّٰهِ وَيَقْتُلُونَ النَّبِيِّنَ بِغَيْرِ حَقٍّ
وَيَقْتُلُونَ الَّذِينَ يَاْمُرُونَ بِالْقِسْطِ مِنَ النَّاسِ فَبَشِّرْهُمْ بِعَذَابٍ اَلِيمٍ ﴿٢١﴾

---

qrupa parçalanması, bir-birilərini təkfir etmələri, bunların hamısı zahirdə alim, batində və həqiqətdə cahildən betər və nadan şəxslərin hakimiyyət arzusundan meydana gəlibdir. Qurani-Şərifi və hədisləri istədikləri kimi yozub, cənnəti istədiklərinə bağışlayıb, onun əvəzində xalqın qəlblərini özlərinə meyil etdirib, onların nəzərində adil imam surətində görünərlər. Qurani-Şərifin ayələri onların xəbis əməllərinə zidd olduğuna görə, Quranın tabe olunması vacib olan ehkamlarını gizlədib, öz şəxsi məqsədlərinə nail olmaqdan ötrü uydurma rəvayətlərə yönəlib, Quran ayələrini gizlədib, unutdurarlar). (وَمَنْ يَكْفُرْ بِاٰيَاتِ اللّٰهِ) **- kim Allah-Təalanın ayələrini inkar edib islama daxil olmasa,** (فَاِنَّ اللّٰهَ سَرِيعُ الْحِسَابِ) **- həqiqətən, Allah-Təala qiyamət günündə o şəxsi təcili haqq-hesaba çəkib, sonra möhlət vermədən onu öz cəzasına yetirər.**

**20)** (فَاِنْ حَآجُّوكَ) – (ey Məhəmməd), **əgər əhli-kitab səninlə islam dini haqqında münaqişə və mübahisə etsələr,** (فَقُلْ اَسْلَمْتُ وَجْهِيَ لِلّٰهِ) – (ey Məhəmməd), **de ki, özümü ancaq Allah-Təalaya məxsus etmişəm, heç vaxt ona şərik qoşmamışam.** (وَمَنِ اتَّبَعَنِ) **- və o şəxslər ki mənə tabe olublar, onlar da özlərini Allah-Təalaya məxsus ediblər.** (وَقُلْ لِلَّذِينَ اُوتُوا الْكِتَابَ وَالْاُمِّيِّنَ) – (ey Məhəmməd), **kitab verilən o şəxslərə** (yəhudi və xristianlara), **bir də müşriklərə de ki,** (ءَاَسْلَمْتُمْ) – **bəs bu aşkar olan dəlillərdən sonra islama daxil oldunuz, yoxsa yox?** (فَاِنْ اَسْلَمُوا فَقَدِ اهْتَدَوْا) **- əgər islama daxil olsalar, həqiqətən, hidayət tapdılar,** (وَاِنْ تَوَلَّوْا) – (ey Məhəmməd), **əgər islamdan üz döndərib daxil olmasalar, sənə bir zərər yoxdur.** (فَاِنَّمَا عَلَيْكَ الْبَلَاغُ) **- həqiqətən, sənin təklifin onlara təbliğ etməkdir. Ondan başqa, sənə bir məsuliyyət yoxdur.** (وَاللّٰهُ بَصِيرٌ بِالْعِبَادِ)**- bəndələrinin əhvalından Allah-Təala özü agahdır.**

**21)** (اِنَّ الَّذِينَ يَكْفُرُونَ بِاٰيَاتِ اللّٰهِ) **- həqiqətən, o şəxslər ki Allah-Təalanın kitabı Tövratda zikr olunan ayələri inkar edib,** (وَيَقْتُلُونَ النَّبِيِّنَ بِغَيْرِ حَقٍّ) **- haqsız və səbəbsiz olaraq peyğəmbərləri qətlə yetirirdilər,** (فَبَشِّرْهُمْ بِعَذَابٍ اَلِيمٍ) – (ey Məhəmməd), **qiyamət günündə onları çox şiddətli əzabla müjdələ, (bəni-İsrail peyğəmbərlərdən neçəsini qətlə yetirdi, ondan sonra peyğəmbərlərə iman gətirən şəxslər onlara öyüd-nəsihət etsə də, onlardan bəzisini də peyğəmbərlər kimi qətlə yetirdilər. Sual: bu əməllər Hz. Peyğəmbərin zamanında yaşayan yəhudilərin ata-babalarından meydana gəlibdir, bu əməlləri Hz. Peyğəmbərin dövründə yaşayan yəhudilərə isnad etməkdə**

أُولَٓئِكَ الَّذِينَ حَبِطَتْ اَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْاٰخِرَةِۘ وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ ﴿٢٢﴾ أَلَمْ تَرَ إِلَى الَّذِينَ أُوتُوا
نَصِيبًا مِنَ الْكِتَابِ يُدْعَوْنَ إِلَى كِتَابِ اللّٰهِ لِيَحْكُمَ بَيْنَهُمْ ثُمَّ يَتَوَلَّى فَرِيقٌ مِنْهُمْ وَهُمْ مُعْرِضُونَ ﴿٢٣﴾
ذَلِكَ بِأَنَّهُمْ قَالُوا لَنْ تَمَسَّنَا النَّارُ إِلَّا أَيَّامًا مَعْدُودَاتٍ وَغَرَّهُمْ فِي دِينِهِمْ مَا كَانُوا يَفْتَرُونَ ﴿٢٤﴾

---

**nə fayda vardır? Cavab: iki fayda vardır, birincisi, onları məzəmmət etməkdir, yəni siz belə şəxslərin övladlarısınız, siz də əməllərinizdə ata-babalarınıza oxşayırsınız, ona görə də bu fikirdəsiniz ki, peyğəmbəri qətlə yetirəsiniz,** (yəhudilər həmişə bu fikirdə idilər ki, Hz. Peyğəmbəri qətlə yetirsinlər, neçə dəfə hiylə və məkr etsələr də, aşkar oldu), ikinci fayda odur ki, bu yəhudilər əcdadlarının əməlləri ilə razı olduqları üçün, sanki, o əməlləri bunlar etmiş kimi onlarla şərik hesab olunurlar).

**22) (أُولَٓئِكَ الَّذِينَ حَبِطَتْ اَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْاٰخِرَةِۘ وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ) - o yəhudilər o şəxslərdir ki, onların əməlləri dünya və axirətdə batil olub, Allah-Təalanın əzabından onları qoruyub kömək edən yoxdur.** (Hz. Peyğəmbər yəhudilərin məclislərinə gedib onları islama dəvət edirdi. Yəhudilərdən Nüeym ibn Əmr və Haris ibn Zeyd dedilər: "Ey Məhəmməd, sən özün hansı dindənsən?" O həzrət buyurdu: "Hz. İbrahimin dinindənəm". Dedilər: "İbrahim yəhudi dinində idi". Həzrət buyurdu: Bizim aramızda Tövrat hakim olsun, Tövratı götürüb oxuyun". Yəhudilər qəbul etməyib, Tövratı gətirmədilər, o zaman bu ayə nazil oldu).

**23) (أَلَمْ تَرَ)** – (ey Məhəmməd), **bəs baxmırsan, (yəni bir bu şəxslərə bax, özlərinə Tövrat əhli deyirlər, amma elə ki Tövratın ehkamına dəvət olundular, qəbul etmirlər), (إِلَى الَّذِينَ أُوتُوا نَصِيبًا مِنَ الْكِتَابِ) - o şəxslərə** (yəhudi alimləri) **ki, onlara Tövratdan böyük pay və hissə verilibdir? (يُدْعَوْنَ إِلَى كِتَابِ اللّٰهِ)** – (ey Məhəmməd), **sən onları dəvət edirsən Allah-Təalanın kitabı olan Tövrata, (لِيَحْكُمَ بَيْنَهُمْ) – ta ki Allah-Təala Tövratla onların arasında hökm versin. (ثُمَّ يَتَوَلَّى فَرِيقٌ مِنْهُمْ)** – (ey Məhəmməd), **sən onları Tövrata dəvət edəndən sonra əhli-kitabdan bir camaat** (üləmaları) **Tövratın hökmündən üz döndərib, qəbul etmədilər. (وَهُمْ مُعْرِضُونَ) - yəhudilər elə bir tayfadır ki, onların adətləri həmişə haqdan üz döndərməkdir.**

**24) (ذَلِكَ) - yəhudilərin Tövratın hökmündən üz döndərmələri, (بِأَنَّهُمْ قَالُوا) - o səbəbə görədir ki, yəhudilər belə deyib etiqad edirdilər ki, (لَنْ تَمَسَّنَا النَّارُ إِلَّا أَيَّامًا مَعْدُودَاتٍ) - cəhənnəm odunun əzabı bizə bir neçə gündən artıq toxunmaz, ondan sonra cəhənnəmdən çıxıb əzabdan xilas olarıq. Daha bizə başqa bir şey lazım deyil. Bizim ata-babalarımız peyğəmbərlərdir. Bizdən ötrü şəfaət edərlər. (وَغَرَّهُمْ فِي دِينِهِمْ مَا كَانُوا يَفْتَرُونَ) - onları öz dinlərində yalan deyib iftira etdikləri sözlər məğrur* etdi, o səbəbdən belə dedilər,** (yəhudilər deyirdilər: "Bizim ata-babalarımız peyğəmbərdir, bizdən ötrü şəfa-

فَكَيْفَ إِذَا جَمَعْنَاهُمْ لِيَوْمٍ لَا رَيْبَ فِيهِ وَوُفِّيَتْ كُلُّ نَفْسٍ مَا كَسَبَتْ وَهُمْ لَا يُظْلَمُونَ ﴿٢٥﴾ قُلِ اللَّهُمَّ مَالِكَ الْمُلْكِ تُؤْتِي الْمُلْكَ مَنْ تَشَاءُ وَتَنْزِعُ الْمُلْكَ مِمَّنْ تَشَاءُ وَتُعِزُّ مَنْ تَشَاءُ وَتُذِلُّ مَنْ تَشَاءُ

---

ət edərlər". Bu sözü iftira atıb, yalandan söyləyirdilər, Allah-Təaladan izinsiz kim şəfaət edə bilər?)

*(****Qeyd:*** *İslam ümmətinin təkəbbürlənməsi yəhudilərinki kimidir, necə ki deyirlər: "Son peyğəmbərimiz, onun səhabələri və əhli-beyti, hidayət edən imamlar böyük günahlarımızdan ötrü bizim üçün şəfaət edərlər". Halbuki Allah-Təala böyük günahdan ötrü böyük əzablar vəd edibdir, əgər böyük günah sahibi dünyadan tövbəsiz getsə, həmişə əzabda olacaqdır. Həmin bu yanlış etiqad cahil şəxslərin böyük qəbih və pis əməllərə, hətta ən günah əməl olan qətllərə qurşanmasına səbəb olubdur. Bununla belə, yenə şəfaətlə bağışlanmaq istəyirlər. Cahillərin günahları özlərini alim və müsəlmanların rəisi sayıb onları cəhalətə salan şəxslərdədir. Özgə millətlər də belə xəyal edirlər ki, islamın əsası fitnə-fəsada söykənir. Qurani-Şərifin ayələrinə fikir versinlər ki, hansı dinin kitabında belə qanunlar qeyd olunubdur. Bir neçə avara şəxsə görə böyük və əzəmətli bir ümmətin kitabına və qanununa haqsız sözlər isnad etmək böyük xətadır. Sual: islam alimlərinin icması – ümumi qənaəti ilə Hz. Peyğəmbərimizin ümmətin günahkarlarından ötrü şəfaət etməsi inancı qəbul edilib. Bu ayə ona ziddir. Cavab: Allah-Təalanın izniylə şəfaət iki şeydədir. Biri kiçik günahda, o biri böyük günahda, amma böyük günah sahibi tövbəsiz dünyadan getsə, ondan ötrü şəfaət yoxdur).*

**25) (فَكَيْفَ) - necə olar yəhudilərin halı, (إِذَا جَمَعْنَاهُمْ لِيَوْمٍ لَا رَيْبَ فِيهِ) – o zaman ki onları toplayaq elə bir günün haqq-hesabından ötrü ki, o günün** (qiyamət günü) **vaqe olmasında heç bir şəkk və şübhə yoxdur, (وَوُفِّيَتْ كُلُّ نَفْسٍ مَا كَسَبَتْ) - o gün hər kəsə dünyada qazandığı şey verilər. (وَهُمْ لَا يُظْلَمُونَ) - onlara heç vaxt zülm olunmayıb, öz əməllərinin cəzası onlara yetişəcəkdir.** (Bu ayə yəhudilərin etiqadını – hansı ki deyirdilər: "Bizə əzab olunmaz," - rədd edir. Amma müsəlmanlardan ötrü də bəyan edir ki, müsəlmanlar yəhudilər kimi etiqad etməyib etiqadlarını, gərək, Qurani-Şərifdən alsınlar. Hz. Peyğəmbər Məkkə şəhərini fəth edib alandan sonra səhabələrinə vəd etdi ki, məndən sonra Rum, fars məmləkətlərini fəth edəcəksiniz. Münafiq şəxslər və yəhudilər istehza edib dedilər: "Rum, fars məmləkətlərinə hakim olmaq çox böyük iddiadır", o vaxt da bu ayə nazil oldu, Hz. Peyğəmbərin sözü doğru olub rum, fars məmləkəti onun ümmətinin tabeliyinə keçdi, bu da Hz. Peyğəmbərin haqq olmasına bir dəlildir).

**26) (قُلِ)** – (ey Məhəmməd), **de ki, (اللَّهُمَّ مَالِكَ الْمُلْكِ)- ey mənim Allahım, sən bütün mülklərin maliki və padşahısan, (تُؤْتِي الْمُلْكَ مَنْ تَشَاءُ) – kimə istəsən, səltənət və padşahlıq verərsən, (وَتَنْزِعُ الْمُلْكَ مِمَّنْ تَشَاءُ) - kimdən də istəsən, səltənəti zorla alarsan.** (Padşahlığı əcəmdən ərəbə verməyə qadirsən). **(وَتُعِزُّ مَنْ تَشَاءُ) – kimi istəsən izzətli edərsən, (وَتُذِلُّ مَنْ تَشَاءُ) – kimi də istəsən zəlil**

بِيَدِكَ الْخَيْرُ إِنَّكَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٢٦﴾ تُولِجُ اللَّيْلَ فِي النَّهَارِ وَتُولِجُ النَّهَارَ فِي اللَّيْلِ وَتُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ وَتُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ وَتَرْزُقُ مَنْ تَشَاءُ بِغَيْرِ حِسَابٍ ﴿٢٧﴾ لَا يَتَّخِذِ الْمُؤْمِنُونَ الْكَافِرِينَ أَوْلِيَاءَ مِنْ دُونِ الْمُؤْمِنِينَ وَمَنْ يَفْعَلْ ذَلِكَ فَلَيْسَ مِنَ اللهِ فِي شَيْءٍ إِلَّا أَنْ تَتَّقُوا مِنْهُمْ تُقَاةً وَيُحَذِّرُكُمُ اللَّهُ نَفْسَهُ وَإِلَى اللهِ الْمَصِيرُ ﴿٢٨﴾

---

**edərsən, (بِيَدِكَ الْخَيْرُ) - xeyir vermək sənin əlindədir. Kimə istəsən xeyir verməyə qadirsən. (إِنَّكَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) - həqiqətən, sənsən hər bir şeyə qadir olan və heç bir şey sənin qüdrətindən kənar ola bilməz.**

**27) (تُولِجُ اللَّيْلَ فِي النَّهَارِ) - sənin qüdrətinin əlamətindən biri budur ki, gecəni gündüzə daxil edərsən,** (gecənin gündüzə daxil olması gecənin qısa, gündüzün uzun olmasıdır). **(وَتُولِجُ النَّهَارَ فِي اللَّيْلِ) - gündüzü gecəyə daxil* edərsən,**

*(***Qeyd:** *Gecə və gündüzün uzanıb-qısalmasını qədim astroloqlar yerin sabit və günəşin hərəkət edib yerə tabe olması səbəbi ilə günəşin günün uzanması dairəsinə 24 dərəcə meyil etməsinə və ondan sonra da gündüz və axşamın bərabərliyi dairəsinə dönməsinə isnad ediblər. Amma yeni astronomlar yeri də digər planetlər kimi hərəkətli hesab edib günün uzanıb qısalmasını yerin xüsusi hərəkəti, günəşə olan yaxınlığına və uzaqlığına isnad ediblər. Doğrusunu Allah bilir).*

(gündüzü qısa, gecəni uzun edirsən, gecə və gündüzün qısa və ya uzun olmasının səbəbini onları özü yaratdığı üçün Allah-Təala özünə isnad edir). **(وَتُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ) - dirini ölüdən** (spermadan) **çıxarırsan, (وَتُخْرِجُ الْمَيِّتَ مِنَ الْحَيِّ) - və ölünü** (spermanı) **diridən, (وَتَرْزُقُ مَنْ تَشَاءُ بِغَيْرِ حِسَابٍ) – kimi istəsən, dünyanı onun üzünə açıb saysız-hesabsız ruzi verirsən, heç bir şəxs sənə etiraz edə bilməz.**

**28) (لَا يَتَّخِذِ الْمُؤْمِنُونَ الْكَافِرِينَ أَوْلِيَاءَ مِنْ دُونِ الْمُؤْمِنِينَ) - möminlər möminlərdən başqasını, kafirləri özlərinə dost etməsinlər, gərək, möminlər möminlərlə dostluq etsinlər, müşriklərlə dostluq etmək caiz deyildir. (وَمَنْ يَفْعَلْ ذَلِكَ) – kim müşrikləri özünə dost etsə, (فَلَيْسَ مِنَ اللهِ فِي شَيْءٍ) - o şəxs Allah-Təalanın dostluğundan heç bir şeyə sahib deyildir.** (Müşriklərlə dostluq edən şəxs Allah-Təalanın dostluğundan kənardır). **(إِلَّا أَنْ تَتَّقُوا مِنْهُمْ تُقَاةً) - müşrikləri heç vaxt özünüzə dost edə bilməzsiniz, ancaq sizin onlardan bir qorxunuz olsa, o zaman onlarla zahirdə dostluq edə bilərsiniz). (وَيُحَذِّرُكُمُ اللَّهُ نَفْسَهُ) - Allah-Təala sizi özünün əzabı ilə qorxudur, gərək, Allah-Təaladan qorxub, səbəbsiz yerə müşriklərlə dostluq etməyəsiniz. (وَإِلَى اللهِ الْمَصِيرُ) - bütün məxluqatın son qayıdacağı yer Allah-Təaladır. Əlbəttə, o vaxtın əzabından, gərək, qorxasınız.**

قُلْ إِنْ تُخْفُوا مَا فِي صُدُورِكُمْ أَوْ تُبْدُوهُ يَعْلَمْهُ اللَّهُ وَيَعْلَمُ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ
وَاللَّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٢٩﴾ يَوْمَ تَجِدُ كُلُّ نَفْسٍ مَا عَمِلَتْ مِنْ خَيْرٍ مُحْضَرًا وَمَا عَمِلَتْ
مِنْ سُوءٍ تَوَدُّ لَوْ أَنَّ بَيْنَهَا وَبَيْنَهُ أَمَدًا بَعِيدًا وَيُحَذِّرُكُمُ اللَّهُ نَفْسَهُ وَاللَّهُ رَءُوفٌ بِالْعِبَادِ ﴿٣٠﴾ قُلْ
إِنْ كُنْتُمْ تُحِبُّونَ اللَّهَ فَاتَّبِعُونِي يُحْبِبْكُمُ اللَّهُ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿٣١﴾ قُلْ
أَطِيعُوا اللَّهَ وَالرَّسُولَ فَإِنْ تَوَلَّوْا فَإِنَّ اللَّهَ لَا يُحِبُّ الْكَافِرِينَ ﴿٣٢﴾

---

**29) (قُلْ) –** (ey Məhəmməd), **de: "Ey möminlər, (إِنْ تُخْفُوا مَا فِي صُدُورِكُمْ أَوْ تُبْدُوهُ يَعْلَمْهُ اللَّهُ) - əgər qəlbinizdə olan şeyi** (müşriklərə olan məhəbbəti) **gizlətsəniz, ya da aşkar etsəniz, Allah-Təala ondan agahdır. (وَيَعْلَمُ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ) - Göylərdə və yerdə olan hər bir şeyi Allah-Təala biləndir. (وَاللَّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) - Allah-Təala hər bir şeyə qadirdir. O cümlədən müşriklərlə dostluq etdiyinizə görə, sizə əzab etməyə qadirdir".**

**30) (يَوْمَ تَجِدُ كُلُّ نَفْسٍ مَا عَمِلَتْ مِنْ خَيْرٍ مُحْضَرًا) - qiyamət günü elə bir gündür ki, hər bir kəs dünyada etdiyi xeyir əməli orada yanında hazır tapar,** (məyusluqdan sonra, nəhayət şad olar). **(وَمَا عَمِلَتْ مِنْ سُوءٍ) - yenə hər bir kəs o günah əməli ki, edibdir, qiyamət günündə onları da yanında hazır tapar.** (O zaman məyusluğu daha da artıb, son dərəcə qəm-qüssəyə düçar olar). **(تَوَدُّ لَوْ أَنَّ بَيْنَهَا وَبَيْنَهُ أَمَدًا بَعِيدًا) - o zaman o günahkar şəxs istəyər ki, kaş onunla o pis əməlin arasında uzaq bir məsafə olaydı. Ta ki o pis olan əməlini görməyəydi. (وَيُحَذِّرُكُمُ اللَّهُ نَفْسَهُ ) - Allah-Təala sizi öz əzabı ilə qorxudur ki, qəbih olan əməlləri tərk edəsiniz. (وَاللَّهُ رَءُوفٌ بِالْعِبَادِ) - Allah-Təala bəndələrinə qarşı mehribandır, onları qorxudub, öz elm və qüdrətini onlardan ötrü bəyan edir ki, Allah-Təalanı bilib, Onun razılığını əldə edib, ilahi əzabdan əmin-amanlıqda olsunlar.** (Müşriklər deyirdilər: "Bizim Allah-Təalaya məhəbbətimiz vardır, onu sevirik, o səbəbdən bu bütlərə ibadət edirik ki, bizi Allah-Təalaya yaxınlaşdırsınlar". O zaman bu ayə nazil oldu).

**31) (قُلْ إِنْ كُنْتُمْ تُحِبُّونَ اللَّهَ فَاتَّبِعُونِي يُحْبِبْكُمُ اللَّهُ وَيَغْفِرْ لَكُمْ ذُنُوبَكُمْ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ) –** (ey Məhəmməd), **müşriklərə de ki, əgər Allah-Təalanı sevirsinizsə, mənə tabe olun, çünki Allah-Təalanı sevən onun peyğəmbərinə tabe olar. O zaman Allah-Təala da sizi sevib, günahlarınızı bağışlayar, Allah-Təala bəndələrinin günahlarını bağışlayıb onlara rəhm edəndir.**

**32) (قُلْ أَطِيعُوا اللَّهَ وَالرَّسُولَ فَإِنْ تَوَلَّوْا فَإِنَّ اللَّهَ لَا يُحِبُّ الْكَافِرِينَ) –** (ey Məhəmməd), **de ki, gəlib Allah-Təalaya və onun peyğəmbərinə** (Hz. Məhəmmədə) **itaət edin, əgər itaət etməyib üz döndərsələr, həqiqətən, Allah-Təala kafir olan şəxsləri sevməz. Allah-Təalanın sevmədiyi şəxslər, əlbəttə, əzabda olacaq.**

**إِنَّ اللَّهَ اصْطَفَى آدَمَ وَنُوحًا وَآلَ إِبْرَاهِيمَ وَآلَ عِمْرَانَ عَلَى الْعَالَمِينَ ﴿٣٣﴾ ذُرِّيَّةً بَعْضُهَا مِنْ بَعْضٍ وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ ﴿٣٤﴾ إِذْ قَالَتِ امْرَأَةُ عِمْرَانَ رَبِّ إِنِّي نَذَرْتُ لَكَ مَا فِي بَطْنِي مُحَرَّرًا فَتَقَبَّلْ مِنِّي إِنَّكَ أَنْتَ السَّمِيعُ الْعَلِيمُ ﴿٣٥﴾ فَلَمَّا وَضَعَتْهَا قَالَتْ رَبِّ إِنِّي وَضَعْتُهَا أُنْثَى**

---

**33) (إِنَّ اللَّهَ اصْطَفَى آدَمَ وَنُوحًا وَآلَ إِبْرَاهِيمَ وَآلَ عِمْرَانَ عَلَى الْعَالَمِينَ) -** (bu ayə və bundan sonra gələn ayələr Hz. Məryəm və Hz. İsanın anadan olması və sair əhvalatlarından ötrü bir müqəddimədir. Ayənin mənası belədir:) **həqiqətən, Allah-Təala Adəmi, Nuhu, ali-İbrahimi,* və ali-İmranı məxluqatın içindən seçib, onları öz aləmlərində olan məxluqata üstün etdi.**

*(*Qeyd:* *Ali - böyük şəxsin nəslinə və ona yaxın olan şəxslərə deyilir, Ali-İbrahim İsmayıl, İshaq və onların övladlarıdır, Ali-İmran Məryəm və onun oğlu İsadır. Hz. Musanın atasının adı İmrandır, ayədən məqsəd, Məryəmin atası olan İmran Masan oğludur. Musanın atası olan İmran Yəshur oğlu deyil. Bundan sonra gələn 35-ci ayə buna işarə edir ki, bu ayədəki İmrandan məqsəd Məryəmin atası olan İmrandır. İki İmranın arası 1800 ildir).*

**34) (ذُرِّيَّةً بَعْضُهَا مِنْ بَعْضٍ وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ) - bu qeyd olunanların hamısı bir-birinin övladlarıdır. Adəmə qədər hamısı bir-birindən törəyib, Allah-Təala insanların sözlərini eşidib, peyğəmbərlikdən ötrü kimi seçəcəyini bilir.** (İmranın xanımı, Məryəmin anasının adı Hannə Faquza qızıdır, onun övladı yox idi. Bir gün Hannə bir ağacın kölgəsində əyləşərkən baxıb gördü ki, ağacın üstündə bir quş öz balasına yemək verir. Hannənin qəlbi hüznlənib Allah-Təaladan övlad istədi. Allah-Təala onun duasını qəbul edib ona övlad verdi. Elə ki hamilə oldu, dedi: "Mən nəzir etdim ki, bu bətnimdə olan uşağı Beytül-müqəddəsə xidmətçi verim". Bu nəzirdən onun təmənnası bu idi ki, bətnində olan uşaq oğlan olsun, çünki Beytül-müqəddəsin xidmətçiləri kişilərdən ibarət idi. Amma onun arzusunun ziddi olub, onun bətnində olan uşaq qız oldu. Necə ki Allah-Təala xəbər verir:).

**35) (إِذْ قَالَتِ امْرَأَةُ عِمْرَانَ) – o zaman ki İmranın xanımı, Məryəmin anası öz rəbbi Allah-Təalanı çağırıb dedi: (رَبِّ إِنِّي نَذَرْتُ لَكَ مَا فِي بَطْنِي مُحَرَّرًا) - "Ey mənim rəbbim, həqiqətən, mən nəzir etdim ki, səndən ötrü bu bətnimdə olan uşaq hər bir işdən azad olub, ancaq Beytül-müqəddəsə xidmətçi olsun. (فَتَقَبَّلْ مِنِّي) - məndən bu nəziri qəbul et. (إِنَّكَ أَنْتَ السَّمِيعُ الْعَلِيمُ) - həqiqətən, mənim dua və yalvarışımı eşidib niyyətimdən agah olan sənsən".**

**36) (فَلَمَّا وَضَعَتْهَا) – o zaman ki Məryəmin anası bətnində olan uşağı doğdu, elə ki onun qız olduğunu gördü, qəlbi qırılıb dedi: (قَالَتْ رَبِّ إِنِّي وَضَعْتُهَا أُنْثَى) - "Ey mənim rəbbim, həqiqətən, mən bu bətnimdə olanı qız olaraq doğdum",** (çünki onun fikir və xəyalındakı bu idi ki, oğlan olsun. Elə bu təmənna və xəyalla bətnindəkini Beytül-müqəddəsə nəzir etmişdi.

وَاللَّهُ أَعْلَمُ بِمَا وَضَعَتْ وَلَيْسَ الذَّكَرُ كَالْأُنْثَى وَإِنِّي سَمَّيْتُهَا مَرْيَمَ وَإِنِّي أُعِيذُهَا بِكَ وَذُرِّيَّتَهَا مِنَ الشَّيْطَانِ الرَّجِيمِ ﴿٣٦﴾ فَتَقَبَّلَهَا رَبُّهَا بِقَبُولٍ حَسَنٍ وَأَنْبَتَهَا نَبَاتًا حَسَنًا وَكَفَّلَهَا زَكَرِيَّا

---

Doğanda uşağın qız olduğunu biləndən sonra həsrət və peşmançılıq çəkdi)**.** **(**وَاللَّهُ أَعْلَمُ بِمَا وَضَعَتْ**)** - (ey Məhəmməd), **Allah-Təala agah idi ki, İmranın xanımının doğduğunda nə qədər şan və cəlal vardır, necə pak və təmiz olan övlad ondan əmələ gələcəkdir. Amma İmranın xanımı onun şan və rütbəsindən agah deyildi, o səbəbdən həsrət və peşmançılıq çəkib oğlan istəmişdi, (**وَلَيْسَ الذَّكَرُ كَالْأُنْثَى**)** – (ey Məhəmməd)**, o oğlan ki onu Məryəmin anası təmənna edib istəyirdi, şan və cəlalda ona bəxş etdiyimiz qız kimi ola bilməzdi. (**وَإِنِّي سَمَّيْتُهَا مَرْيَمَ**) -** (bu kəlam Məryəmin anasının kəlamıdır, Allah-Təala Məryəmin anasının kəlamının arasında Məryəmin fəzilətini öz peyğəmbəri Hz. Məhəmmədə (ə.s), bildirib ondan sonra yenə Məryəmin anasının kəlamına döndü). **Məryəmin anası həsrət və peşmanlığını izhar edəndən sonra dedi: "Ey mənim rəbbim, mən bu övladı "Məryəm"** (Mariya) **adlandırdım.** (Mariya yəhudi dilində abid qadın mənasındadır, ərəb dilində Məryəm deyilir). **(**وَإِنِّي أُعِيذُهَا بِكَ وَذُرِّيَّتَهَا مِنَ الشَّيْطَانِ الرَّجِيمِ**) - həqiqətən, ey mənim rəbbim, mən sənə sığınıram və bu Məryəmi, ondan əmələ gələcək övladlarını sənin dərgahından qovulan şeytandan sənə tapşırıram. Onları himayə et ki, şeytanın şərindən qorunmuş olsunlar".** (Məryəmin anasının xahişi o idi ki, Məryəmin çox övladı olsun, amma bizim islam alimlərinin deməyinə görə, təkcə İsanın anası oldu, lakin İncildə Məryəmin İsadan sonra bir neçə övladı olduğu göstərilir. Əlbəttə, bu barədə İncildə qeyd olunanlar, gərək, qəbul olunsun). O zaman ki Məryəmin anası Məryəmi götürüb Beytül-müqəddəsə getdi, (Beytül-müqəddəsin xidmətçiləri Harun peyğəmbərin nəslindən olan 27 nəfər kişi idi, onlara) –dedi: "Bu uşaq, Beytül-müqəddəsə nəzirdir, bu nəziri məndən qəbul edin. Anası Məryəmə hamilə olan vaxt atası İmran dünyadan köçdü. Məryəmin atası bəni-İsrailin rəislərindən olduğundan Beytül-müqəddəsin 27 nəfər xidmətçisinin hamısı onu himayə etmək istədilər. Zəkəriyyə dedi: "Onu himayə etməyə ən layiq olan mənəm, çünki onun xalası mənim xanımımdır". Xidmətçilər qəbul etməyib dedilər: "Püşk atılsın". Bir çayın sahilinə gəldilər, dəmir qələmlərini suyun içinə atdılar ki, kimin qələmi suyun üzərində qalsa, o şəxs Məryəmi himayə etsin, Zəkəriyyənin qələmi suyun üzərində qaldı, o səbəbdən Zəkəriyyə Məryəmi himayə edib ona tərbiyə verdi. Elə ki həddi-büluğa yetişdi, Zəkəriyyə ondan ötrü hündür bir otaq tikdi, Məryəm orada ibadətlə məşğul oldu). (Bu püşk atmaq məsələsi 45-ci ayədə bəyan olunacaqdır).

**37) (**فَتَقَبَّلَهَا رَبُّهَا بِقَبُولٍ حَسَنٍ**) - Məryəmin rəbbi Allah-Təala Məryəmi oğlan nəzirinin əvəzində gözəl şəkildə qəbul etdi. (**وَأَنْبَتَهَا نَبَاتًا حَسَنًا**) - ona Zəkəriyyə vasitəsiylə gözəl şəkildə tərbiyə verdi. (**وَكَفَّلَهَا زَكَرِيَّا**) - Allah-Təala Məryəmi**

كُلَّمَا دَخَلَ عَلَيْهَا زَكَرِيَّا الْمِحْرَابَ وَجَدَ عِنْدَهَا رِزْقًا قَالَ يَا مَرْيَمُ أَنَّى لَكِ هَذَا قَالَتْ هُوَ مِنْ عِنْدِ
اللَّهِ إِنَّ اللَّهَ يَرْزُقُ مَنْ يَشَاءُ بِغَيْرِ حِسَابٍ ﴿٣٧﴾ هُنَالِكَ دَعَا زَكَرِيَّا رَبَّهُ قَالَ رَبِّ هَبْ لِي مِنْ لَدُنْكَ
ذُرِّيَّةً طَيِّبَةً إِنَّكَ سَمِيعُ الدُّعَاءِ ﴿٣٨﴾ فَنَادَتْهُ الْمَلَائِكَةُ وَهُوَ قَائِمٌ يُصَلِّي فِي الْمِحْرَابِ أَنَّ اللَّهَ يُبَشِّرُكَ
بِيَحْيَى مُصَدِّقًا بِكَلِمَةٍ مِنَ اللَّهِ وَسَيِّدًا وَحَصُورًا وَنَبِيًّا مِنَ الصَّالِحِينَ ﴿٣٩﴾ قَالَ رَبِّ أَنَّى يَكُونُ لِي
غُلَامٌ وَقَدْ بَلَغَنِيَ الْكِبَرُ وَامْرَأَتِي عَاقِرٌ قَالَ كَذَلِكَ اللَّهُ يَفْعَلُ مَا يَشَاءُ ﴿٤٠﴾

---

**Zəkəriyyə peyğəmbərə tapşırdı. (كُلَّمَا دَخَلَ عَلَيْهَا زَكَرِيَّا الْمِحْرَابَ) – nə zaman ki Zəkəriyyə Məryəmin yanına - ibadətgahına daxil olurdu, (وَجَدَ عِنْدَهَا رِزْقًا) - onun yanında ruzi - mövsümsüz meyvələri tapardı. (قَالَ يَا مَرْيَمُ أَنَّى لَكِ هَذَا) - Zəkəriyyə o meyvələrə baxıb dedi: "Ey Məryəm, bu mövsümsüz ruzilər səndə hardandır?" (قَالَتْ هُوَ مِنْ عِنْدِ اللَّهِ) - dedi: "O ruzi Allah-Təalanın yanından gəlmiş ruzidir, (إِنَّ اللَّهَ يَرْزُقُ مَنْ يَشَاءُ بِغَيْرِ حِسَابٍ) - həqiqətən, Allah-Təala istədiyinə saysız-hesabsız ruzi verər".**

**38) (هُنَالِكَ دَعَا زَكَرِيَّا رَبَّهُ قَالَ رَبِّ هَبْ لِي مِنْ لَدُنْكَ ذُرِّيَّةً طَيِّبَةً إِنَّكَ سَمِيعُ الدُّعَاءِ) -** (Hz. Zəkəriyyənin övladı yox idi. Elə ki Məryəmdə bu kəraməti gördü, o vaxt Allaha dua edib) **dedi: "Ey mənim rəbbim, mənə öz yanından pak olan bir övlad bəxş et, duaları eşidib qəbul edən sənsən".**

**39) (فَنَادَتْهُ الْمَلَائِكَةُ وَهُوَ قَائِمٌ يُصَلِّي فِي الْمِحْرَابِ) - elə ki Zəkəriyyə ibadətgahda namazla məşğul olduğu halda bu duanı etdi, Allah-Təala tərəfindən olan mələk onu çağırıb dedi: (أَنَّ اللَّهَ يُبَشِّرُكَ بِيَحْيَى) - "Ey Zəkəriyyə, həqiqətən, Allah-Təala səni bir oğulla müjdələyir ki, onun adı, gərək, Yəhya olsun. (مُصَدِّقًا بِكَلِمَةٍ مِنَ اللَّهِ) - təsdiq edəndir o şəxsi** (İsanı) **ki, Allah-Təalanın kəlməsiylə və əmri ilə mövcud olubdur, (Bu səbəbdən Hz. İsaya "kəlimətullah" – Allahın sözü deyilir). (وَسَيِّدًا) - Yəhya öz qövmünün arasında böyük və ağa olar, (وَحَصُورًا) – qadınları istədiyi halda evlənməyib, özünü qoruyub nəfsani arzuları tərk edər. (وَنَبِيًّا مِنَ الصَّالِحِينَ) və saleh şəxslərdən bir peyğəmbər olar.** (Zəkəriyyə və xanımı qocalmışdılar, adət üzrə onların övladının olması mümkün deyildi. Zəkəriyyə istədi bilsin ki, Allah-Təala onlara necə övlad verəcəkdir? O səbəbdən sual verdi. Necə ki sıradakı ayədə xəbər verir).

**40) (قَالَ رَبِّ أَنَّى يَكُونُ لِي غُلَامٌ) - Zəkəriyyə dedi: "Ey mənim rəbbim, mənim necə oğlum olar? (وَقَدْ بَلَغَنِيَ الْكِبَرُ) - həqiqətən, mənə qocalıq üz verib, (وَامْرَأَتِي عَاقِرٌ) – xanımımın da doğmaq vaxtı keçibdir,"** (o vaxt Zəkəriyyə 99 yaşında, xanımı 98 yaşında idi)**. (قَالَ كَذَلِكَ) - Allah-Təala buyurdu: "Ey Zəkəriyya, belədir ki, deyirsən, adət üzrə sizdən övlad olmaz. (اللَّهُ يَفْعَلُ مَا يَشَاءُ) - amma Allah-Təala qoca kişi və qoca qadından övlad gətirməyə qadirdir. Nə istəsə, edər".**

قَالَ رَبِّ اجْعَلْ لِي آيَةً قَالَ آيَتُكَ أَلَّا تُكَلِّمَ النَّاسَ ثَلَاثَةَ أَيَّامٍ إِلَّا رَمْزًا وَاذْكُرْ رَبَّكَ كَثِيرًا وَسَبِّحْ بِالْعَشِيِّ
وَالْإِبْكَارِ ﴿٤١﴾ وَإِذْ قَالَتِ الْمَلَائِكَةُ يَا مَرْيَمُ إِنَّ اللَّهَ اصْطَفَاكِ وَطَهَّرَكِ وَاصْطَفَاكِ عَلَى نِسَاءِ الْعَالَمِينَ
﴿٤٢﴾ يَا مَرْيَمُ اقْنُتِي لِرَبِّكِ وَاسْجُدِي وَارْكَعِي مَعَ الرَّاكِعِينَ ﴿٤٣﴾ ذَلِكَ مِنْ أَنْبَاءِ الْغَيْبِ نُوحِيهِ
إِلَيْكَ وَمَا كُنْتَ لَدَيْهِمْ إِذْ يُلْقُونَ أَقْلَامَهُمْ أَيُّهُمْ يَكْفُلُ مَرْيَمَ وَمَا كُنْتَ لَدَيْهِمْ إِذْ يَخْتَصِمُونَ ﴿٤٤﴾

---

**41) (قَالَ رَبِّ اجْعَلْ لِي آيَةً) - Zəkəriyyə dedi: "Ey mənim rəbbim, mənə bir əlamət göstər. O əlamət səbəbinə o uşağın doğum vaxtı mənə məlum olsun. Ta ki o böyük nemətə şükür edim". (قَالَ آيَتُكَ أَلَّا تُكَلِّمَ النَّاسَ ثَلَاثَةَ أَيَّامٍ إِلَّا رَمْزًا) - Allah-Təala buyurdu: "Sənin üçün əlamət budur ki, 3 gün insanlarla danışmağa qadir olmazsan, ancaq işarə ilə** (danışarsan). (Elə ki Hz. Zəkəriyyənin dili tutuldu, o vaxt məlum oldu ki, doğum vaxtıdır, amma dua vaxtı dili rəvan idi. O səbəbdən Allah buyurur:) **(وَاذْكُرْ رَبَّكَ كَثِيرًا وَسَبِّحْ بِالْعَشِيِّ وَالْإِبْكَارِ) - ey Zəkəriyya, rəbbin Allah-Təalanı şam və sübh vaxtlarında çox zikr edib hər bir eyibdən və nöqsandan pak və münəzzəh say".** (Zəkəriyyə Allah-Təalanın zikri ilə məşğul olub doğum vaxtı tamam olanda Hz. Yəhya dünyaya gəldi).

**42) (وَإِذْ قَالَتِ الْمَلَائِكَةُ يَا مَرْيَمُ إِنَّ اللَّهَ اصْطَفَاكِ وَطَهَّرَكِ وَاصْطَفَاكِ عَلَى نِسَاءِ الْعَالَمِينَ) – O zaman ki Allah-Təala tərəfindən mələklər Məryəmə dedilər: "Ey Məryəm, həqiqətən, Allah-Təala səni seçdi,** (o vaxt ki səni Beytül-müqəddəsə xidmətçi etdi) **və səni hər bir eyibdən pak və münəzzəh edib, seçib, bütün dünya qadınlarından üstün etdi".**

**43) (يَا مَرْيَمُ اقْنُتِي لِرَبِّكِ وَاسْجُدِي وَارْكَعِي مَعَ الرَّاكِعِينَ) - "Ey Məryəm, öz rəbbinə itaət et, səcdə edib rüku edənlərlə, rüku edib namaz qılanlarla birlikdə namaz qıl".**

**44) (ذَلِكَ مِنْ أَنْبَاءِ الْغَيْبِ) - ey Məhəmməd, bu keçən xəbərlər** (Məryəm, İsa və Zəkəriyyənin xəbərləri) **sənə qeyb xəbərlərindəndir. (نُوحِيهِ إِلَيْكَ) - o xəbərləri sənə vəhy edib öyrədirik.** (Vəhy olmasaydı, Hz. Peyğəmbər bu xəbərlərdən agah ola bilməzdi. Çünki bu xəbərləri heç kimdən eşitməyib və kitablarda da oxumamışdı. Necə ki bu mətləbə iman gətirməyənlərin özləri də iqrar edirdilər, bəs bu xəbərlərdən necə agah oldu? Necə ki buyurur, ancaq Allah-Təalanın vəhyi ilə agah oldu). **(وَمَا كُنْتَ لَدَيْهِمْ)** – (ey Məhəmməd), **sən Beytül-müqəddəsin xidmətçilərinin yanında deyildin, (إِذْ يُلْقُونَ أَقْلَامَهُمْ) - o zaman ki qələmlərini suyun içinə saldılar, (أَيُّهُمْ يَكْفُلُ مَرْيَمَ) – ta ki hansı biri Məryəmi himayə etsin,** (necə ki yuxarıda qeyd olundu). **(وَمَا كُنْتَ لَدَيْهِمْ) - yenə sən onların yanında deyildin ki, gözlə görəydin, (إِذْ يَخْتَصِمُونَ) - o zaman ki Məryəmi himayə etmək haqqında bir-biriləri ilə mübahisə edirdilər.** (ey Məhəmməd), bu xəbərləri sən gözlə görməyib, eşitməyib, oxumayıbsan, bəs

إِذْ قَالَتِ الْمَلَائِكَةُ يَا مَرْيَمُ إِنَّ اللَّهَ يُبَشِّرُكِ بِكَلِمَةٍ مِنْهُ اسْمُهُ الْمَسِيحُ عِيسَى ابْنُ مَرْيَمَ وَجِيهًا فِي الدُّنْيَا وَالْآخِرَةِ وَمِنَ الْمُقَرَّبِينَ ﴿٤٥﴾ وَيُكَلِّمُ النَّاسَ فِي الْمَهْدِ وَكَهْلًا وَمِنَ الصَّالِحِينَ ﴿٤٦﴾ قَالَتْ رَبِّ أَنَّى يَكُونُ لِي وَلَدٌ وَلَمْ يَمْسَسْنِي بَشَرٌ قَالَ كَذَلِكِ اللَّهُ يَخْلُقُ مَا يَشَاءُ إِذَا قَضَى أَمْرًا فَإِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونُ ﴿٤٧﴾ وَيُعَلِّمُهُ الْكِتَابَ وَالْحِكْمَةَ وَالتَّوْرَاةَ وَالْإِنْجِيلَ ﴿٤٨﴾

---

bunlardan necə agah oldun? Ancaq bizim öyrətməyimizlə olmadınmı?)

**45) (إِذْ قَالَتِ الْمَلَائِكَةُ يَا مَرْيَمُ) – o zaman ki mələk Məryəmə dedi: "Ey Məryəm, (إِنَّ اللَّهَ يُبَشِّرُكِ) - həqiqətən, Allah-Təala səni müjdələyir, (بِكَلِمَةٍ مِنْهُ اسْمُهُ الْمَسِيحُ عِيسَى ابْنُ مَرْيَمَ) - öz tərəfindən bir kəlməylə,** (yəni Allah-Təalanın bir kəlməsi və əmri ilə atasız doğulan oğulla)**, onun adı Məsihdir** (Mübarəkdir), **İsa* Məryəm oğludur. (وَجِيهًا فِي الدُّنْيَا وَالْآخِرَةِ) - dünyada, axirətdə şərəf və uca mərtəbə sahibidir,** (dünyada peyğəmbərlik, axirətdə cənnətdə uca dərəcə sahibidir)**. (وَمِنَ الْمُقَرَّبِينَ) - Allah-Təalaya yaxın şəxslərdəndir".**

*(****Qeyd:*** *Sual: Allah-Təala niyə Hz. İsa dünyaya gəlməmiş onu anasına isnad edib İsa Məryəm oğlu adlandırdı? Cavab: ona görə ki, Məryəm qoy əvvəlcədən bilsin ki, Allah-Təala ona atasız oğul verəcəkdir. Övlad ataya isnad edilər. Elə ki Məryəmə isnad edildi, Məryəm bildi ki, bu oğul atasız olacaqdır. Odur ki, Məryəm bu sözdən qorxub, böyük iztirab çəkdi. Sual verib dedi: "İlahi, mənim ki ərim yoxdur, bir oğlum necə olsun?" Necə ki bundan sonra qeyd olunur, əgər Məryəmə isnad edilməsəydi, Məryəm bilməzdi ki, oğlu atasız olacaqdır, iztirab da çəkməzdi. Ehtimal edərdi ki, ərə gedəndən sonra uşağı olacaq).*

**46) (وَيُكَلِّمُ النَّاسَ فِي الْمَهْدِ وَكَهْلًا وَمِنَ الصَّالِحِينَ) - ey Məryəm, bu İsa ki sənə verəcəyəm, uşaq olaraq həm beşikdə, həm də böyük olandan sonra kişi olaraq insanlarla danışar, onun danışığında uşaqlıqla böyüklüyünün arasında heç bir fərq olmaz. Özü də saleh şəxslərdən olar.**

**47) (قَالَتْ رَبِّ أَنَّى يَكُونُ لِي وَلَدٌ) - Məryəm dedi: "Ey mənim rəbbim, mənim övladım necə olar? ( وَلَمْ يَمْسَسْنِي بَشَرٌ) – halbuki heç bir insanın orqanı mənim bədənimə toxunmayıbdır". (Bu kəlam Məryəmdən təəccüb və iztirabla meydana gəldi. Necə ola bilər ki, ərsiz qadın uşaq doğsun?) (قَالَ كَذَلِكِ) - Allah-Təala buyurdu: "Ey Məryəm, belədir ki, deyirsən, adət üzrə ərsiz qadının övladı olmaz. (اللَّهُ يَخْلُقُ مَا يَشَاءُ) - amma Allah-Təala istədiyini yaradar, (إِذَا قَضَى أَمْرًا) – nə zaman bir şeyin olmasına hökm versə, (فَإِنَّمَا يَقُولُ لَهُ كُنْ فَيَكُونُ) - həqiqətən, o şeyə ol deyər, o şey də o an olar".** (Allah-Təalanın deməsi məcazi mənada və bizə bildirməkdən ötrüdür, Allah-Təalanın işlərində demək yoxdur, Allah-Təala bir şeyin olmasını istəsə, o şey o anda mövcud olar).

**48) (وَيُعَلِّمُهُ الْكِتَابَ وَالْحِكْمَةَ) –** (Ey Məryəm), **Allah-Təala İsaya yazmağı və bütün şeylərin həqiqətini öyrədər. (وَالتَّوْرَاةَ وَالْإِنْجِيلَ) - Tövratı və İncili də ona öyrədər.**

وَرَسُولًا إِلَى بَنِي إِسْرَائِيلَ أَنِّي قَدْ جِئْتُكُمْ بِآيَةٍ مِنْ رَبِّكُمْ أَنِّي أَخْلُقُ لَكُمْ مِنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ
فَأَنْفُخُ فِيهِ فَيَكُونُ طَيْرًا بِإِذْنِ اللهِ وَأُبْرِئُ الْأَكْمَهَ وَالْأَبْرَصَ وَأُحْيِي الْمَوْتَى بِإِذْنِ اللهِ وَأُنَبِّئُكُمْ بِمَا
تَأْكُلُونَ وَمَا تَدَّخِرُونَ فِي بُيُوتِكُمْ إِنَّ فِي ذَلِكَ لَآيَةً لَكُمْ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿٤٩﴾ وَمُصَدِّقًا لِمَا بَيْنَ
يَدَيَّ مِنَ التَّوْرَاةِ وَلِأُحِلَّ لَكُمْ بَعْضَ الَّذِي حُرِّمَ عَلَيْكُمْ وَجِئْتُكُمْ بِآيَةٍ مِنْ رَبِّكُمْ فَاتَّقُوا اللهَ وَأَطِيعُونِ
﴿٥٠﴾ إِنَّ اللهَ رَبِّي وَرَبُّكُمْ فَاعْبُدُوهُ هَذَا صِرَاطٌ مُسْتَقِيمٌ ﴿٥١﴾

---

**49) (وَرَسُولًا إِلَى بَنِي إِسْرَائِيلَ) - Onu* bəni-İsrailə peyğəmbər göndərər".** (Elə ki Allah-Təala Hz. İsaya peyğəmbərlik verib onu bəni-İsrailə göndərdi, başladı onları dəvət etməyə). **(أَنِّي قَدْ جِئْتُكُمْ بِآيَةٍ مِنْ رَبِّكُمْ) -** (Hz. İsa bəni-İsrailə deyir:) **"Ey bəni-İsrail, həqiqətən, mən sizin rəbbiniz Allah-Təala tərəfindən bir neçə möcüzələrlə sizə peyğəmbər gəlmişəm. O möcüzələr bunlardır: (أَنِّي أَخْلُقُ لَكُمْ مِنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ) - həqiqətən, mən sizin üçün palçıqdan quş surətinin eynisini düzəldərəm, (فَأَنْفُخُ فِيهِ فَيَكُونُ طَيْرًا بِإِذْنِ اللهِ) - o surətə nəfəs verərəm, Allah-Təalanın izniylə quş olar. (وَأُبْرِئُ الْأَكْمَهَ وَالْأَبْرَصَ) – anadangəlmə korları və cüzam xəstəliyi olanları sağaldıb şəfa verərəm. (وَأُحْيِي الْمَوْتَى بِإِذْنِ اللهِ) - Allah-Təalanın izniylə ölüləri dirildirəm.(وَأُنَبِّئُكُمْ بِمَا تَأْكُلُونَ) - sizə yediyiniz şeyləri xəbər verərəm, (وَمَا تَدَّخِرُونَ فِي بُيُوتِكُمْ) - və o şeyləri ki evlərinizdə yığıb saxlayıbsiniz, onu da sizə xəbər verərəm. (إِنَّ فِي ذَلِكَ لَآيَةً لَكُمْ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ) - əgər iman gətirib Allah-Təalanın möcüzələrini təsdiq edənsinizsə, həqiqətən, sizdən ötrü bu qeyd olunan möcüzələrdə mənim haqq peyğəmbər olmağıma işarə vardır".**

*(****Qeyd:*** *Necə ki bu ayədə buyurdu, Hz. İsa məhz bəni-İsrail tayfasına göndərilmişdi. Amma bizim uca peyğəmbərimiz dünya insanlarına göndərilmişdi. Necə ki bundan sonra gələn ayələrdən məlum olur, adət üzrə dünya əhlinə təbliğ etdi. Yaxınlara özü deməklə, uzaqlara məktub yazmaqla. Peyğəmbərlərdən cəmi iki nəfər bütün insanlığa göndərilibdir. Biri Hz. İbrahim, ikincisi Hz. Məhəmməddir ə.s).*

**50) (وَمُصَدِّقًا لِمَا بَيْنَ يَدَيَّ مِنَ التَّوْرَاةِ) -** (İsa deyir:) **"Məndən qabaq sizə nazil olan Tövratı təsdiq etdiyim halda, sizə göndərilmişəm". (وَلِأُحِلَّ لَكُمْ بَعْضَ الَّذِي حُرِّمَ عَلَيْكُمْ) – ta ki sizə halal edim bəzi o şeyləri ki, Tövratda sizə haram edilibdir. (وَجِئْتُكُمْ بِآيَةٍ مِنْ رَبِّكُمْ) - mənim peyğəmbərliyimin doğruluğuna işarə edən möcüzə ilə sizin rəbbiniz Allah-Təala tərəfindən sizə peyğəmbər gəlmişəm. (فَاتَّقُوا اللهَ وَأَطِيعُونِ) - Allah-Təaladan qorxub mənə itaət edin.**

**51) (إِنَّ اللهَ رَبِّي وَرَبُّكُمْ فَاعْبُدُوهُ) - həqiqətən*, mənim və sizin rəbbiniz Allah-Təaladır, ona ibadət edin. (هَذَا صِرَاطٌ مُسْتَقِيمٌ) - budur doğru olan yol"** (Allah-Təalanı bir bilib müvəhhid olmaq yolu)**.**

*(****Qeyd:*** *Hz. İsanın doğruluğunun dəlili yuxarıda qeyd olunan möcüzə və bu kəlamdır, çünki bütün peyğəmbərlər gəlib bu kəlamı deyiblər).*

فَلَمَّا أَحَسَّ عِيسَى مِنْهُمُ الْكُفْرَ قَالَ مَنْ أَنْصَارِي إِلَى اللَّهِ قَالَ الْحَوَارِيُّونَ نَحْنُ أَنْصَارُ اللَّهِ آمَنَّا بِاللَّهِ
وَاشْهَدْ بِأَنَّا مُسْلِمُونَ ﴿٥٢﴾ رَبَّنَا آمَنَّا بِمَا أَنْزَلْتَ وَاتَّبَعْنَا الرَّسُولَ فَاكْتُبْنَا مَعَ الشَّاهِدِينَ ﴿٥٣﴾
وَمَكَرُوا وَمَكَرَ اللَّهُ وَاللَّهُ خَيْرُ الْمَاكِرِينَ ﴿٥٤﴾ إِذْ قَالَ اللَّهُ يَا عِيسَى إِنِّي مُتَوَفِّيكَ وَرَافِعُكَ إِلَيَّ
وَمُطَهِّرُكَ مِنَ الَّذِينَ كَفَرُوا وَجَاعِلُ الَّذِينَ اتَّبَعُوكَ فَوْقَ الَّذِينَ كَفَرُوا

---

**52) (فَلَمَّا أَحَسَّ عِيسَى مِنْهُمُ الْكُفْرَ) - nə zaman ki İsa onların küfründən şübhəsiz bir şəkildə agah oldu,** (çünki onun dəvətini qəbul etmədilər), **(قَالَ مَنْ أَنْصَارِي إِلَى اللَّهِ) - dedi: "Kimdir o şəxslər ki özlərini Allah-Təalaya isnad edib mənə kömək olsunlar?" (قَالَ الْحَوَارِيُّونَ) - İsanın həvariləri dedilər: "(نَحْنُ أَنْصَارُ اللَّهِ) - Bizik Allah-Təala dininin köməkçiləri, (آمَنَّا بِاللَّهِ) - iman gətirdik Allah-Təalaya, (وَاشْهَدْ بِأَنَّا مُسْلِمُونَ) –** (ey İsa), **şahid ol, həqiqətən, Allah-Təalaya itaət edənik".**

**53) (رَبَّنَا آمَنَّا بِمَا أَنْزَلْتَ وَاتَّبَعْنَا الرَّسُولَ فَاكْتُبْنَا مَعَ الشَّاهِدِينَ) - yenə* həvarilər dedilər:) "Ey bizim rəbbimiz, iman gətirmişik hər o hökmə ki, sən onu nazil edibsən və tabe olduq bu İsa peyğəmbərə, bizim adlarımızı qiyamət günündə insanların əməllərinə şahid olan peyğəmbərlərin cərgəsində yazıb sabit et".**

**54) (وَمَكَرُوا وَمَكَرَ اللَّهُ وَاللَّهُ خَيْرُ الْمَاكِرِينَ) - kafirlər məkr və hiylə etdilər ki, Hz. İsanı qətlə yetirsinlər. Onların məkr və hiylələrinin müqabilində Allah-Təala onların cəzasını verdi.** (O şəxs ki Hz. İsanın məxfi qaldığı yeri kafirlərə nişan verdi, onu tutub Hz. İsanın əvəzində qətlə yetirdilər. Hz. İsanı Allah-Təala vəfat etdirib səmaya apardı)**. Allah-Təala məkr və hiylə müqabilində cəza verənlərin ən üstünüdür** (ən yaxşı cəza verəndir)**.**

**55) (إِذْ قَالَ اللَّهُ يَا عِيسَى) - Allah-Təala kafirlərin məkrlərinin müqabilində cəzalarını verdi. O zaman ki İsaya dedi: "Ey İsa, (إِنِّي مُتَوَفِّيكَ وَرَافِعُكَ إِلَيَّ) - həqiqətən,* səni kafirlərin qətlə yetirməsindən qoruyaram, ondan sonra səni vəfat etdirib, ruhunu alıb, ucaldıb mələklərim olan məkana aparacağam. (وَمُطَهِّرُكَ مِنَ الَّذِينَ كَفَرُوا) - səni inkar edən şəxslərlə müsahib olmandan səni pak edib kənar edəcəyəm. (وَجَاعِلُ الَّذِينَ اتَّبَعُوكَ فَوْقَ الَّذِينَ كَفَرُوا) - ey İsa,** səni tabe olan şəxsləri qiyamətə kimi səni inkar edən şəxslərə hakim edib uca edəcəyəm".**

*(*Qeyd:* *Bu ayə buna işarə edir ki, kafirlər Hz. İsanı öldürməyib, Allah-Təala özü onu vəfat etdirib, ondan sonra müqəddəs ruhunu ruhlar aləminə aparmışdır. Amma Hz. İsanın sağ ikən bədəniylə birlikdə səmalara aparılması barədə hədislər də var. Bu ayə və bundan başqa ayələrdə bu mətləbə işarə yoxdur. Biz də, gərək, Qurana tabe olub, hər bir söz ki, Qurana müxalifdir, onu qəbul etməyək).*

إِلَى يَوْمِ الْقِيَامَةِ ثُمَّ إِلَيَّ مَرْجِعُكُمْ فَأَحْكُمُ بَيْنَكُمْ فِيمَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ ﴿٥٥﴾ فَأَمَّا الَّذِينَ كَفَرُوا
فَأُعَذِّبُهُمْ عَذَابًا شَدِيدًا فِي الدُّنْيَا وَالْآخِرَةِ وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ ﴿٥٦﴾ وَأَمَّا الَّذِينَ آمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ فَيُوَفِّيهِمْ أُجُورَهُمْ وَاللَّهُ لَا يُحِبُّ الظَّالِمِينَ ﴿٥٧﴾ ذَلِكَ نَتْلُوهُ عَلَيْكَ مِنَ الْآيَاتِ وَالذِّكْرِ
الْحَكِيمِ ﴿٥٨﴾ إِنَّ مَثَلَ عِيسَى عِنْدَ اللَّهِ كَمَثَلِ آدَمَ خَلَقَهُ مِنْ تُرَابٍ ثُمَّ قَالَ لَهُ كُنْ فَيَكُونُ ﴿٥٩﴾
الْحَقُّ مِنْ رَبِّكَ فَلَا تَكُنْ مِنَ الْمُمْتَرِينَ ﴿٦٠﴾

---

*(****Qeyd:** Bu, bizim peyğəmbərin doğruluğu haqqında bir möcüzə və böyük bir dəlildir, 1319 il bundan əvvəl Hz. Peyğəmbər bu xəbəri Qurani-Şərifdə veribdir. Bu zamana kimi də bu xəbərin doğruluğu zahir və aşkardır. Hz. İsaya tabe olanlar xristianlar və müsəlmanlardır. Bu iki ümmət Hz. İsanı inkar edən yəhudilərə hakim və qalibdirlər. Bu kimi öncədən deyilən səhih xəbərlər Hz. Peyğəmbərin doğruluğuna böyük dəlil hesab olunur).*

**(إِلَى يَوْمِ الْقِيَامَةِ ثُمَّ إِلَيَّ مَرْجِعُكُمْ) – ey İsaya tabe olmayıb, kafir olanlar, öləndən sonra sizin qayıdacağınız yer mənim tərəfimə olacaqdır. (فَأَحْكُمُ بَيْنَكُمْ) – mənim tərəfimə qayıdandan sonra qiyamət günündə sizin aranızda hökm edəcəyəm. (فِيمَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ) – o şeydə ki dünyada ixtilaf edirdiniz,** (Hz. İsa haqqında bəziniz Allah, bəziniz Allahın oğlu dediniz, bəziniz atasız olduğuna görə, ona çirkin sözlər isnad etdiniz)**.**

**56) (فَأَمَّا الَّذِينَ كَفَرُوا فَأُعَذِّبُهُمْ عَذَابًا شَدِيدًا فِي الدُّنْيَا وَالْآخِرَةِ وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ) - amma o şəxslər ki** (yəhudilər) **İsanı inkar edib, həm dünyada, həm də axirətdə onlara şiddətli və möhkəm əzab edərəm,** (dünyada zəlil olmaq, axirətdə cəhənnəm əzabı). **Onlardan ötrü kömək olan da tapılmaz ki, onları əzabımdan xilas etsin.**

**57) (وَأَمَّا الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَيُوَفِّيهِمْ أُجُورَهُمْ وَاللَّهُ لَا يُحِبُّ الظَّالِمِينَ) - amma o şəxslər ki İsaya iman gətirib saleh əməl etdilər, Allah-Təala onların əcr, savablarını tamamən onlara yetirər. Allah-Təala zalım şəxsləri sevməz.**

**58) (ذَلِكَ نَتْلُوهُ عَلَيْكَ مِنَ الْآيَاتِ وَالذِّكْرِ الْحَكِيمِ) –** (ey Məhəmməd)**, Hz. İsanın bu xəbərləri ki, sənə oxuyub deyirik, möcüzə və hikmətli sözlərdəndir.**

**59) (إِنَّ مَثَلَ عِيسَى عِنْدَ اللَّهِ كَمَثَلِ آدَمَ خَلَقَهُ مِنْ تُرَابٍ ثُمَّ قَالَ لَهُ كُنْ فَيَكُونُ) – (ey Hz. İsanın atasız yaradılmasını inkar edənlər), həqiqətən, Allah-Təala yanında İsanın məsəli anasız yaradılmış Adəmin məsəli kimidir. Allah-Təala Adəmi atasız-anasız torpaqdan yaratdı. Elə ki onun mayasını torpaqdan düzəltdi, ondan sonra ona dedi: "Var ol!" Adəmin bədəninə o anda ruh daxil olub o, var oldu.** (Allah-Təala Adəmi torpaqdan atasız-anasız yaratmağa qadir olduğu kimi, Hz. İsanı da atasız yaratmağa qadirdir).

**60) (الْحَقُّ مِنْ رَبِّكَ فَلَا تَكُنْ مِنَ الْمُمْتَرِينَ) -** (ey Məhəmməd)**, Hz. İsanın bu xəbərləri sənin rəbbin Allah-Təaladan haqq olan xəbərlərdir. Bu xəbərlərə şəkk**

فَمَنْ حَاجَّكَ فِيهِ مِنْ بَعْدِ مَا جَاءَكَ مِنَ الْعِلْمِ فَقُلْ تَعَالَوْا نَدْعُ أَبْنَاءَنَا وَأَبْنَاءَكُمْ وَنِسَاءَنَا وَنِسَاءَكُمْ وَأَنْفُسَنَا وَأَنْفُسَكُمْ ثُمَّ نَبْتَهِلْ فَنَجْعَلْ لَعْنَةَ اللّٰهِ عَلَى الْكَاذِبِينَ ﴿٦١﴾

---

**edən şəxslərdən olma.** (Hz. Peyğəmbərin şanı bu xəbərlərə şəkk etməkdən ucadır. Allah-Təalanın belə deməsi onun qəlbini rahatlatmaqdan ötrüdür. Bir də bu xəbərlərə şəkk edən başqa şəxslərə işarədir). (Nəcran Ərəbistanında bir yer adıdır. Oranın əhalisinin hamısı xristian idi. Onların üləmasından bir qrup Hz. Peyğəmbərin hüzuruna gəlib Hz. İsa haqqında danışdılar. Dedilər: "Hz. İsa Allah-Təalanın oğludur". Hz. Peyğəmbər buyurdu: "Allah-Təala pak və münəzzəhdir ki, Onun oğlu olsun, Hz. İsa Allah-Təalanın pak bəndəsidir. Onu öz məxluqatına peyğəmbər göndəribdir". Onlar qəbul etmədilər. O zaman Allah-Təala sıradakı "mübahələ" (bəddua)* ayəsini nazil etdi).

**61) (فَمَنْ حَاجَّكَ فِيهِ) -** (ey Məhəmməd)**, kim** (Nəcran xristianları) **səninlə Hz. İsa haqqında mübahisə və münaqişə edib Hz. İsanı Allah-Təalanın oğlu sayır, (مِنْ بَعْدِ مَا جَاءَكَ مِنَ الْعِلْمِ) - Hz. İsa haqqında** (Quranda) **sənə elm gəlib, onun əhvalatından agah olandan sonra, (فَقُلْ تَعَالَوْا نَدْعُ أَبْنَاءَنَا وَأَبْنَاءَكُمْ) –** (ey Məhəmməd)****, onlara de:**

*(****Qeyd:** Bu ayə buna işarə edir ki, Allah-Təala yanında peyğəmbərdən sonra səhabələrin ən üstünü Əli, Fatimə, Həsən və Hüseyndir. Çünki Hz. Peyğəmbər dua zamanı müsəlmanların içindən bunlardan başqasını "mübahələ" üçün ortaya çıxartmadı. (Hz. Peyğəmbərin xanımı Aişə deyir: "Mübahələ günündə peyğəmbər çiynində qara tüklü bir əbaya bənzər yun bir əba ("kisa" - libas) ilə gəldi. Sonra Həsən gəldi, onu parçanın altına daxil etdi, ondan sonra Hüseyn gəldi, onu da parçanın altına daxil etdi. Ondan sonra Fatimə gəldi, onu da parçanın altına daxil etdi, ondan sonra Əli gəldi, onu da daxil etdi. Ondan sonra bu ayəni oxudu: "Ey əhli-beyt, Allah günahlarınızı yox edib, sizi tərtəmiz etmək istəyir". (əl-Əhzab, 33), yəni Allah-Təala siz əhli-beyti hər bir eyib və nöqsandan pak və münəzzəh edibdir, buyurdu").*

**gəlin, biz çağırıb gətirək öz oğullarımızı, siz də öz oğullarınızı, (وَنِسَاءَنَا وَنِسَاءَكُمْ) - biz öz qadınlarımızı, siz də öz qadınlarınızı, (وَأَنْفُسَنَا وَأَنْفُسَكُمْ) - biz özümüzü və o şəxsi ki, bizim özümüz kimi olsun. Siz də özünüzü və o şəxsi ki, sizin özünüz kimi olsun, bunları siz də gətirin, biz də gətirək. (ثُمَّ نَبْتَهِلْ فَنَجْعَلْ لَعْنَةَ اللّٰهِ عَلَى الْكَاذِبِينَ) - ondan sonra bir-birimizə bəddua edib, bizdən və sizdən yalançı olanlara Allah-Təalanın lənətini diləyək. Kim ki yalançıdır, Allah-Təalanın lənəti onu tutsun.** (Hz. Peyğəmbər bu ayəni Nəcran xristianlarına oxuydu, onlar da qəbul etdilər. Lənətləşməni səhərə saxladılar. O gecə xristianlar yığılıb məşvərət etdilər. Onların arasında ən ağıllı iki nəfər var idi. Birinin adı Aqib, o birinin adı Seyd* idi, dedilər: "Ey xristianlar, səhər baxıb görün, əgər bu şəxs mübahələyə çox adamla gəlsə, ondan qorxmayın, o, peyğəmbər deyildir. Çünki peyğəmbər olan şəxs camaata və köməyə baxmaz. Amma əgər az adamla gəlsə, mübahələni tərk edin".

إِنَّ هَذَا لَهُوَ الْقَصَصُ الْحَقُّ وَمَا مِنْ إِلَهٍ إِلَّا اللَّهُ وَإِنَّ اللَّهَ لَهُوَ الْعَزِيزُ الْحَكِيمُ ﴿٦٢﴾ فَإِنْ تَوَلَّوْا فَإِنَّ اللَّهَ
عَلِيمٌ بِالْمُفْسِدِينَ ﴿٦٣﴾ قُلْ يَا أَهْلَ الْكِتَابِ تَعَالَوْا إِلَى كَلِمَةٍ سَوَاءٍ بَيْنَنَا وَبَيْنَكُمْ أَلَّا نَعْبُدَ إِلَّا اللَّهَ وَلَا
نُشْرِكَ بِهِ شَيْئًا

---

*(*****Qeyd:*** *Seyd - canavar mənasındadır. Amma səhv olaraq səyyad kimi oxunur).*

Xristianlar Mədinədən kənarda yerləşmişdilər. O biri tərəfdən Hz. Peyğəmbər hökm etdi ki, səhər Mədinə əhlindən bir nəfər də şəhərdən kənara çıxmasın. Səhər olanda Hz. Peyğəmbər nəvəsi Hüseyni qucağına alıb o biri nəvəsi Həsənin əlindən tutub, qızı Fatimeyi-Zəhra, onun arxasınca əmisi oğlu və kürəkəni Hz. Əli şəhərdən bir yerdə çıxdılar. Xristianlar Hz. Peyğəmbəri bu halətdə görəndə Seyd və Aqib dedilər: "Ey xristianlar, bu üzlər ki bizə tərəf gəlir, əgər bu üzlər Allah-Təalanı çağırıb bu dağları yerindən qaldırmasını istəsələr, mütləq qaldırarlar. Bir nəfər də xristian yer üzündə qalmaz, siz bilirsiniz ki, Məhəmməd peyğəmbərdir. Əgər öz dininizdə qalmaq istəyirsinizsə, onunla sülh bağlayıb, öz yurdunuza qayıdın". Xristianlar bu təklifi qəbul edib, peyğəmbərin hüzuruna gəlib dedilər: "Ey Əbül-Qasım, biz səninlə mübahələ etmirik". Peyğəmbər buyurdu: "Müsəlman olun". Dedilər: "Müsəlman da olmuruq, xahiş edirik ki, öz dinimizdə qalıb sənə cizyə və xərac verək". Hz. Peyğəmbər qəbul edib belə sülh bağladılar ki, hər il 2 min dəst libas - min dəstini Səfər ayında, min dəstini Rəcəb ayında versinlər. 30 dəmir zireh, 33 dəvə, 34 cins at versinlər. Bu şəkildə sülh bağlayıb qayıtdılar).

**62) (إِنَّ هَذَا)** – (ey Məhəmməd)**, həqiqətən, Hz. İsanın bu xəbərləri (لَهُوَ الْقَصَصُ الْحَقُّ) - əlbəttə, haqq olan qissələrdir. (وَمَا مِنْ إِلَهٍ إِلَّا اللَّهُ) - Allah-Təaladan başqa, heç bir haqq olan məbud yoxdur, İsa da Onun bəndəsidir. Necə demək olar ki, İsa Allah, ya da Allahın oğludur. (وَإِنَّ اللَّهَ لَهُوَ الْعَزِيزُ الْحَكِيمُ) - həqiqətən, Allah-Təala məxluqata qalib olub hər bir işi hikmət üzrə edəndir.**

**63) (فَإِنْ تَوَلَّوْا فَإِنَّ اللَّهَ عَلِيمٌ بِالْمُفْسِدِينَ)** – (ey Məhəmməd)**, əgər əhli-kitab səndən üz döndərib iman etməsələr, həqiqətən, Allah-Təala fəsadçı şəxslərdən (hansılar ki Allah-Təalaya şərik qoşub, fəsad törədirlər) agahdır və onların cəzalarını verəcəkdir.**

**64) (قُلْ يَا أَهْلَ الْكِتَابِ)** – (ey Məhəmməd)**, əhli-kitaba de ki, ey əhli-kitab, (تَعَالَوْا إِلَى كَلِمَةٍ) - gəlin o bir kəlmə tərəfinə, siz də mənimlə o kəlmədə birləşin. (سَوَاءٍ بَيْنَنَا وَبَيْنَكُمْ) - o kəlmə bizimlə siz əhli-kitab arasında eynidir, o kəlmədə nə Quranda, nə Tövratda, nə də İncildə heç bir ixtilaf yoxdur, gəlin o kəlməni mənimlə birlikdə deyin, tamamən qardaş olaq. O kəlmə budur: (أَلَّا نَعْبُدَ إِلَّا اللَّهَ) - müvəhhid olub bir olan Allah-Təaladan başqasına ibadət etməyin, (وَلَا نُشْرِكَ بِهِ شَيْئًا) - heç bir şeyi Allah-Təalaya şərik qoş-**

وَلَا يَتَّخِذَ بَعْضُنَا بَعْضًا أَرْبَابًا مِنْ دُونِ اللهِ فَإِنْ تَوَلَّوْا فَقُولُوا اشْهَدُوا بِأَنَّا مُسْلِمُونَ ﴿٦٤﴾ يَا أَهْلَ الْكِتَابِ لِمَ تُحَاجُّونَ فِي إِبْرَاهِيمَ وَمَا أُنْزِلَتِ التَّوْرَاةُ وَالْإِنْجِيلُ إِلَّا مِنْ بَعْدِهِ أَفَلَا تَعْقِلُونَ ﴿٦٥﴾ هَا أَنْتُمْ هَؤُلَاءِ حَاجَجْتُمْ فِيمَا لَكُمْ بِهِ عِلْمٌ فَلِمَ تُحَاجُّونَ فِيمَا لَيْسَ لَكُمْ بِهِ عِلْمٌ وَاللهُ يَعْلَمُ وَأَنْتُمْ لَا تَعْلَمُونَ ﴿٦٦﴾ مَا كَانَ إِبْرَاهِيمُ يَهُودِيًّا وَلَا نَصْرَانِيًّا وَلَكِنْ كَانَ حَنِيفًا مُسْلِمًا وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ ﴿٦٧﴾

---

**mayın. (وَلَا يَتَّخِذَ بَعْضُنَا بَعْضًا أَرْبَابًا مِنْ دُونِ اللهِ) - Allah-Təalanı buraxıb, bəzimiz digərlərini özündən ötrü sahib və tərbiyə verən rəbb qəbul etməsin.** (Yəni siz yəhudilər, deməyin ki, Üzeyir Allah-Təalanın oğludur, siz xristianlar deməyin ki, Məsih Allah, ya da Allah-Təalanın oğludur, bu sözləri tərk edin. Hamımız bir olan Allah-Təalaya sitayiş edib "La ilahə illəllah", - deyib müvəhhid olaq). **(فَإِنْ تَوَلَّوْا) –** (ey Məhəmməd)**, əgər əhli-kitab bu sözləri səndən qəbul etməyib üz döndərsələr, (فَقُولُوا اشْهَدُوا) - siz müsəlmanlar əhli-kitaba deyin: "İndi ki bu kəlməni iqrar etmədiniz, şahidlik edin ki, (بِأَنَّا مُسْلِمُونَ) - həqiqətən, Allah-Təalaya itaət edən bizik, siz deyilsiniz.** (Yəhudilər dedilər: "Hz. İbrahim bizdəndir", xristianlar dedilər: "Bizdəndir". Allah-Təala sıradakı ayədə onların dediklərini rədd edib buyurur:).

**65) (يَا أَهْلَ الْكِتَابِ) - Ey əhli-kitab,* (لِمَ تُحَاجُّونَ فِي إِبْرَاهِيمَ) – niyə İbrahim haqqında münaqişə və mübahisə edirsiniz? (وَمَا أُنْزِلَتِ التَّوْرَاةُ وَالْإِنْجِيلُ إِلَّا مِنْ بَعْدِهِ) - Tövrat və İncil ancaq ondan sonra nazil olubdur, (necə ola bilər ki, İbrahim yəhudi, ya da xristian olsun? (أَفَلَا تَعْقِلُونَ) – niyə ağlınızla hərəkət etmirsiniz ki, sözünüzün batil olmağına agah olasınız).**

*(****Qeyd:*** *əhli- kitab yəhudi, xristian və ataşpərəstlərdən ibarətdir).*

**66) (هَا أَنْتُمْ هَؤُلَاءِ حَاجَجْتُمْ فِيمَا لَكُمْ بِهِ عِلْمٌ) - ey əhli-kitab, o şey barəsində mübahisə və münaqişə edirsiniz ki, ona elminiz vardır. (Tövrat və İncildə qeyd olunan sözlərdən danışırsınız, bunda eyib yoxdur). (فَلِمَ تُحَاجُّونَ فِيمَا لَيْسَ لَكُمْ بِهِ عِلْمٌ) - amma o şey barəsində ki, elminiz yoxdur, nəyə görə mübahisə və münaqişə edirsiniz?** (Deyirsiniz ki, Hz. İbrahim yəhudi, ya da xristian idi)**. (وَاللهُ يَعْلَمُ) - Allah-Təala Hz. İbrahimin əhvalından agahdır. (وَأَنْتُمْ لَا تَعْلَمُونَ) - siz isə agah deyilsiniz.** (Növbəti ayədə Allah-Təala İbrahimin əhvalından agah olduğunu bəyan edir)**.**

**67) (مَا كَانَ إِبْرَاهِيمُ يَهُودِيًّا وَلَا نَصْرَانِيًّا) - İbrahim nə yəhudi, nə də xristian deyildi. (وَلَكِنْ كَانَ حَنِيفًا مُسْلِمًا) - İbrahim ancaq batildən haqq tərəfinə meyil edib hər bir işində Allah-Təalaya itaət edən şəxs idi. (وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ) – o, müşriklərdən deyildi. İslam dini tövhiddən ibarətdir. Hz. İbrahim də müvəhhid şəxs idi. Amma siz yəhudi və xristianlar Allah-Təalaya şərik qoşursunuz. Necə olur ki, İbrahim sizdən olur?** (Yəhudilər deyirdilər: "Üze-

إِنَّ أَوْلَى النَّاسِ بِإِبْرَاهِيمَ لَلَّذِينَ اتَّبَعُوهُ وَهَذَا النَّبِيُّ وَالَّذِينَ آمَنُوا وَاللَّهُ وَلِيُّ الْمُؤْمِنِينَ ﴿٦٨﴾ وَدَّتْ طَائِفَةٌ
مِنْ أَهْلِ الْكِتَابِ لَوْ يُضِلُّونَكُمْ وَمَا يُضِلُّونَ إِلَّا أَنْفُسَهُمْ وَمَا يَشْعُرُونَ ﴿٦٩﴾ يَا أَهْلَ الْكِتَابِ لِمَ تَكْفُرُونَ
بِآيَاتِ اللَّهِ وَأَنْتُمْ تَشْهَدُونَ ﴿٧٠﴾ يَا أَهْلَ الْكِتَابِ لِمَ تَلْبِسُونَ الْحَقَّ بِالْبَاطِلِ وَتَكْتُمُونَ الْحَقَّ وَأَنْتُمْ تَعْلَمُونَ
﴿٧١﴾ وَقَالَتْ طَائِفَةٌ مِنْ أَهْلِ الْكِتَابِ آمِنُوا بِالَّذِي أُنْزِلَ عَلَى الَّذِينَ آمَنُوا وَجْهَ النَّهَارِ وَاكْفُرُوا آخِرَهُ

---

yir Allah-Təalanın oğludur". Xristianlar deyirdilər: "Məsih Allah-Təalanın oğludur").

**68) (إِنَّ أَوْلَى النَّاسِ بِإِبْرَاهِيمَ لَلَّذِينَ اتَّبَعُوهُ)** – (ey yəhudi və xristianlar, siz deyirsiniz ki, İbrahimə yaxın olan şəxslər bizik, belə deyil, ona siz yaxın deyilsiniz), **həqiqətən, İbrahimə yaxın olan şəxslər o şəxslərdir ki, onun zamanında ona tabe olublar. (وَهَذَا النَّبِيُّ وَالَّذِينَ آمَنُوا) - bir də bu peyğəmbər** (Hz. Məhəmməd ə.s) **və ona iman gətirənlər. Bunlardır Hz. İbrahimə yaxın olan şəxslər, nəinki siz. (وَاللَّهُ وَلِيُّ الْمُؤْمِنِينَ) - möminlərin işlərini idarə edib onlara kömək olan Allah-Təaladır.**

**69) (وَدَّتْ طَائِفَةٌ مِنْ أَهْلِ الْكِتَابِ) - əhli-kitabdan bir tayfa istər ki, (لَوْ يُضِلُّونَكُمْ) - bəlkə, sizi zəlalətə salıb islam dinindən çıxarıb yəhudi dininə daxil etsin. (وَمَا يُضِلُّونَ إِلَّا أَنْفُسَهُمْ) – onlar ancaq özlərini zəlalətə salarlar,** (yəhudilərin sizin islamdan çıxıb zəlalətə düşməyinizi istəməsi özlərini zəlalətə salmaqdır). **(وَمَا يَشْعُرُونَ) - amma onlar anlamırlar, Allah-Təala o zəlalət səbəbi ilə onlara əzab edəcəkdir.**

**70) (يَا أَهْلَ الْكِتَابِ لِمَ تَكْفُرُونَ بِآيَاتِ اللَّهِ وَأَنْتُمْ تَشْهَدُونَ) - ey əhli-kitab, nəyə görə Qurani-Şərifi inkar edib bu peyğəmbəri təsdiq etmirsiniz? Halbuki özünüz şahidlik edirsiniz ki, bu peyğəmbərin xüsusiyyətləri sizin kitabda qeyd olunubdur.**

**71) (يَا أَهْلَ الْكِتَابِ لِمَ تَلْبِسُونَ الْحَقَّ بِالْبَاطِلِ وَتَكْتُمُونَ الْحَقَّ وَأَنْتُمْ تَعْلَمُونَ) - ey əhli-kitab, nəyə görə haqqa batil libası geyindirib** (haqqı batil surətində göstərirsiniz)**, haqqı (Hz. Məhəmmədin peyğəmbər olmasını) gizlədirsiniz, halbuki** (onun peyğəmbər olmasından) **özünüz agahsınız.** (Yəhudilərin üləmasından 12 nəfər məşvərət edib dedilər: "Gəlin günortadan əvvəl islama daxil olaq, elə ki günorta oldu, yenə öz dinimizə qayıdıb deyək ki, kitabımıza baxdıq, o peyğəmbər ki, bizim kitabımızda qeyd olunubdur, o, Məhəmməd deyildir. Ondan başqasıdır, bundan sonra gələcəkdir", - o zaman bu ayə nazil oldu).

**72) (وَقَالَتْ طَائِفَةٌ مِنْ أَهْلِ الْكِتَابِ) - əhli-kitabdan bir qrup** (12 nəfər yəhudi alimi) **dedilər: "(آمِنُوا بِالَّذِي أُنْزِلَ عَلَى الَّذِينَ آمَنُوا وَجْهَ النَّهَارِ) – möminlərə nazil olan o kitaba** (Qurana) **iman gətirin, bu iman gətirməyiniz günortadan əvvəl olsun. (وَاكْفُرُوا آخِرَهُ) - ondan sonra həmin günün axırında axşam vaxtı yenə**

لَعَلَّهُمْ يَرْجِعُونَ ﴿٧٢﴾ وَلَا تُؤْمِنُوا إِلَّا لِمَنْ تَبِعَ دِينَكُمْ قُلْ إِنَّ الْهُدَى هُدَى اللّٰهِ أَنْ يُؤْتَى أَحَدٌ مِثْلَ مَا
أُوتِيتُمْ أَوْ يُحَاجُّوكُمْ عِنْدَ رَبِّكُمْ قُلْ إِنَّ الْفَضْلَ بِيَدِ اللّٰهِ يُؤْتِيهِ مَنْ يَشَاءُ وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ ﴿٧٣﴾ يَخْتَصُّ
بِرَحْمَتِهِ مَنْ يَشَاءُ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظِيمِ ﴿٧٤﴾ وَمِنْ أَهْلِ الْكِتَابِ مَنْ إِنْ تَأْمَنْهُ بِقِنْطَارٍ يُؤَدِّهِ إِلَيْكَ
وَمِنْهُمْ مَنْ إِنْ تَأْمَنْهُ بِدِينَارٍ لَا يُؤَدِّهِ إِلَيْكَ إِلَّا مَا دُمْتَ عَلَيْهِ قَائِمًا

---

**Quranı inkar edin. (لَعَلَّهُمْ يَرْجِعُونَ) - bəlkə, müsəlmanlar bu səbəbə islam dinindən dönüb yəhudi dininə daxil olarlar”.**

**73) (وَلَا تُؤْمِنُوا) -** (yenə yəhudilər bir-birilərinə dedilər: “Müsəlmanlara zahirdə iman etdiyinizi göstərin), **amma həqiqətdə qəlbinizdə olanı iqrar etməyin. (إِلَّا لِمَنْ تَبِعَ دِينَكُمْ) - ancaq o şəxslərə iqrar və izhar edin ki, sizin dininizə tabe olub sizdən olsunlar.** (Ey Məhəmməd, yəhudilər belə deyirlər)**. (قُلْ إِنَّ الْهُدَى هُدَى اللّٰهِ) - onlara de ki, həqiqətən, hidayət və din Allah-Təalanın hidayəti və dinidir. Kimi istəsə, özü hidayət edər, necə ki məni haqq olan islam dininə hidayət edibdir. (أَنْ يُؤْتَى أَحَدٌ مِثْلَ مَا أُوتِيتُمْ) - siz yəhudilər bu tədbir və hiyləni ona görə etdiniz ki, Allah-Təalanın sizdən başqa bir nəfərə də sizə verdiyi kitabın bənzərini verməsinə həsəd edirdiniz.** (Hz. Məhəmmədə verilən bu Qurana həsəd etdiniz). **(أَوْ يُحَاجُّوكُمْ عِنْدَ رَبِّكُمْ) - yenə qiyamət günündə rəbbiniz Allah-Təalanın yanında Quran əhlinin sizinlə mübahisə edib sizə qalib olacağına həsəd etdiniz. O səbəbdən bu hiyləni (günortadan qabaq müsəlman olaq, günortadan sonra kafir olaq hiyləsi) etdiniz ki, bəlkə, onları dinlərindən qaytarasınız.** (Allah-Təala buyurur:) **(قُلْ إِنَّ الْفَضْلَ بِيَدِ اللّٰهِ) –** (ey Məhəmməd)**, yəhudilərə de ki, iman etmək və hidayət tapmaq Allah-Təaladan bir lütfdür. O lütf Allah-Təalanın əlindədir. (يُؤْتِيهِ مَنْ يَشَاءُ) - kimə istəsə, lütf edib imana hidayət edər. (وَاللّٰهُ وَاسِعٌ عَلِيمٌ) - Allah-Təalanın rəhməti hər şeyi əhatə edər, kimin hidayətə və imana qabil olduğunu bilib ona iman bəxş edər.**

**74) (يَخْتَصُّ بِرَحْمَتِهِ مَنْ يَشَاءُ وَاللّٰهُ ذُو الْفَضْلِ الْعَظِيمِ) - Allah-Təala kimi istəsə, onu** (imana qabil olan şəxsləri) **rəhmətinə aid edib imana hidayət edər. Allah-Təala böyük lütf və rəhmət sahibidir.**

**75) (وَمِنْ أَهْلِ الْكِتَابِ) - əhli-kitabdan vardır, (مَنْ إِنْ تَأْمَنْهُ بِقِنْطَارٍ يُؤَدِّهِ إِلَيْكَ) – elə şəxslər ki, əgər onları əmin bilib çoxlu qızıl və gümüş malı onlara əmanət versən, yenə o malı sahibinə qaytarıb əmanətə xəyanət etməzlər.** (Onlar xristianlardır). **(وَمِنْهُمْ مَنْ إِنْ تَأْمَنْهُ بِدِينَارٍ) - əhli-kitabdan elə şəxslər vardır ki, əgər onları əmin bilib onlara bir dinar əmanət versən, (لَا يُؤَدِّهِ إِلَيْكَ) xəyanət* edib onu sənə qaytarmazlar,** (onlar yəhudilərdir, əmanətə xəyanət etmək onların adətidir). **(إِلَّا مَا دُمْتَ عَلَيْهِ قَائِمًا) - yəhudilər öz ixtiyarları ilə əmanəti qaytarmazlar, ancaq o əmanəti onlardan möhkəm tələb edincə zorla ala bilərsən.**

ذَلِكَ بِأَنَّهُمْ قَالُوا لَيْسَ عَلَيْنَا فِي الْأُمِّيِّينَ سَبِيلٌ وَيَقُولُونَ عَلَى اللهِ الْكَذِبَ وَهُمْ يَعْلَمُونَ ﴿٧٥﴾ بَلَى
مَنْ أَوْفَى بِعَهْدِهِ وَاتَّقَى فَإِنَّ اللهَ يُحِبُّ الْمُتَّقِينَ ﴿٧٦﴾ إِنَّ الَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ اللهِ وَأَيْمَانِهِمْ ثَمَنًا
قَلِيلًا أُولَئِكَ لَا خَلَاقَ لَهُمْ فِي الْآخِرَةِ

---

*(*****Qeyd:*** *Allah-Təala əmanətə xəyanət etməyi haram buyurubdur. Bu ayə nazil olandan sonra Hz. Peyğəmbər buyurdu: "Allah-Təalanın düşmənləri yalandan deyirlər ki, əmanətə xəyanət etmək olar, əlbəttə, əmanətə xəyanət etmək olmaz, cahiliyyə zamanında olan bütün qaydaların hamısı mənim ayağımın altındadır, ancaq əmanət istisnadır. Əmanət sahibi yaxşı, ya pis olsa, mömin, ya fasiq və ya kafir olsa, gərək əmanəti özünə qaytarılsın". İbn Abbas deyir: "Bir kişi Hz. Peyğəmbərdən soruşdu: "ey peyğəmbər, bəzən əhli-zimmənin* ***(yəhudi və xristianların)*** *malını - qoyun və toyuqlarını alırıq". Hz. Peyğəmbər soruşdu:: "Nə deyib onların malını alırsınız?". O kişi cavab verdi: "Biz deyirik ki, onların malını yeməkdə bizə heç bir günah yoxdur". O həzrət buyurdu: "Siz də yəhudilər kimi deyirsiniz ki, əhli-kitabdan başqasının malında bizə heç bir günah yoxdur, əlbəttə, əhli-kitabın malı sizə halal deyil, ancaq özləri halal edərsə, olar". (Müsəlman olan şəxs, gərək, bu ayənin və bu hədisin məzmununa baxıb heç bir şəxsin malını özünə halal saymasın və yəhudilər kimi xalqın əmanətinə xəyanət etməsin").*

**(ذَلِكَ بِأَنَّهُمْ) - yəhudilərin bu əmanətə xəyanət etmələri o səbəbədir ki, (قَالُوا لَيْسَ عَلَيْنَا فِي الْأُمِّيِّينَ سَبِيلٌ) - dedilər: "Əhli-kitabdan başqa, şəxslərin haqqını və onların mallarını almağımızda bizə heç kimin yolu** (ixtiyarı) **və haqqı yoxdur".** (Yəni Allah-Təala əhli-kitab olmayanın malından ötrü bizə əzab etməz). **(وَيَقُولُونَ عَلَى اللهِ الْكَذِبَ) - Allah-Təalaya yalan isnad edib deyirlər: "Allah-Təala Tövratda əhli-kitabdan başqasının malını halal buyurubdur. Allah-Təalaya yalan isnad edirlər. (وَهُمْ يَعْلَمُونَ) - halbuki özləri agahdırlar ki, bu, yalandır və Allaha yalan isnad etmək caiz deyildir".**

**76) (بَلَى مَنْ أَوْفَى بِعَهْدِهِ وَاتَّقَى فَإِنَّ اللهَ يُحِبُّ الْمُتَّقِينَ) -** (əvvəlki ayədə qeyd olundu ki, yəhudilər belə deyirdilər: "Allah-Təala əhli-kitab olmayanın malından ötrü bizə əzab etməz". Bu ayədə "bəla" kəlməsi bunu isbat edir ki, əlbəttə, Allah-Təala onlara əzab edəcəkdir. Ondan sonra buyurur:) **xeyir, kim ki öz əhdinə vəfa etsə, Allah-Təalanın ehkamına əməl edib əmanəti qaytarsa, Allahdan qorxub xəyanəti tərk etsə, həqiqətən, Allah-Təala özündən qorxanları və müttəqiləri sevər.**

**77) (إِنَّ الَّذِينَ يَشْتَرُونَ بِعَهْدِ اللهِ وَأَيْمَانِهِمْ ثَمَنًا قَلِيلًا) - həqiqətən, yəhudilərdən o şəxslər ki Allah-Təalanın əhdini və özlərinin and içməyini** (Allah-Təala Hz. Musanın zamanında Tövrat ehkamına əməl etmək haqqında yəhudilərdən əhd aldı. Onlar da əməl etməyə and içdilər)**, az bir dünya malı** (camaata rəis olub rüşvət almaq) **qarşılığında satıb Allah-Təalanın hökmlərini dəyişdirdilər, (أُولَئِكَ لَا خَلَاقَ لَهُمْ فِي الْآخِرَةِ) - o qeyd olunan yəhudilərdən ötrü**

وَلَا يُكَلِّمُهُمُ اللّٰهُ وَلَا يَنْظُرُ إِلَيْهِمْ يَوْمَ الْقِيَامَةِ وَلَا يُزَكِّيهِمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٧٧﴾ وَإِنَّ مِنْهُمْ لَفَرِيقًا يَلْوُونَ أَلْسِنَتَهُمْ بِالْكِتَابِ لِتَحْسَبُوهُ مِنَ الْكِتَابِ وَمَا هُوَ مِنَ الْكِتَابِ وَيَقُولُونَ هُوَ مِنْ عِنْدِ اللّٰهِ وَمَا هُوَ مِنْ عِنْدِ اللّٰهِ وَيَقُولُونَ عَلَى اللّٰهِ الْكَذِبَ وَهُمْ يَعْلَمُونَ ﴿٧٨﴾ مَا كَانَ لِبَشَرٍ أَنْ يُؤْتِيَهُ اللّٰهُ الْكِتَابَ وَالْحُكْمَ وَالنُّبُوَّةَ ثُمَّ يَقُولَ لِلنَّاسِ كُونُوا عِبَادًا لِي مِنْ دُونِ اللّٰهِ وَلَكِنْ كُونُوا رَبَّانِيِّينَ بِمَا كُنْتُمْ تُعَلِّمُونَ الْكِتَابَ

---

**axirətdə heç bir nəsib və pay yoxdur. (وَلَا يُكَلِّمُهُمُ اللّٰهُ وَلَا يَنْظُرُ إِلَيْهِمْ يَوْمَ الْقِيَامَةِ) - Allah-Təala qiyamət günündə onlarla lütf və rəhmətlə danışmaz, nə də onlara rəhmət nəzəriylə baxmaz. (وَلَا يُزَكِّيهِمْ) - nə də onları günahlardan pak etməz. (وَلَهُمْ عَذَابٌ أَلِيمٌ) - onlardan ötrü axirətdə çox şiddətli əzab vardır.** (Yəhudilərin rəislərindən bir qrup - Kə`b Əşrəf oğlu, Malik Seyf oğlu, Huyey Əxtab oğlu və başqaları müsəlmanlarla Hz. Peyğəmbərin haqqında mübahisə edirdilər. Müsəlmanlar onlara dedilər: “Tövratı gətirib oxuyun, orada Hz. Peyğəmbərin xüsusiyyətləri qeyd olunubdur”. Onlar Tövratı gətirib oxuyanda Hz. Peyğəmbərin xüsusiyyətlərinin əvəzinə başqa sözlər oxudular. Müsəlmanlar Tövratı oxuya bilmirdilər. Ola bilərdi ki, yəhudilərin hiylə və məkrlərinə aldanıb onların sözlərini qəbul etsinlər. O zaman gələn ayə nazil olub Allah-Təala onları xəbərdar etdi ki, yəhudilər Tövratda olan sözlərinin həqiqətini sizə bəyan etmirlər).

**78) (وَإِنَّ مِنْهُمْ لَفَرِيقًا) - həqiqətən, yəhudilərdən bir qrup** (qeyd olunanlar) **vardır, (يَلْوُونَ أَلْسِنَتَهُمْ بِالْكِتَابِ) - Tövratı oxuyanda dillərini haqdan batil tərəfinə əyərlər ki, (لِتَحْسَبُوهُ مِنَ الْكِتَابِ) - siz müsəlmanlar batil olan sözləri Tövratdan hesab edəsiniz. (Çünki siz Tövratı oxuya bilmirsiniz, amma mən sizi xəbərdar edirəm). (وَمَا هُوَ مِنَ الْكِتَابِ) - o batil olan sözlər Allah-Təala tərəfindən gələn sözlər deyildir. (وَيَقُولُونَ عَلَى اللّٰهِ الْكَذِبَ) - yəhudilər Allah-Təalaya yalan isnad edirlər. (وَهُمْ يَعْلَمُونَ) - halbuki özləri bilirdilər ki, o sözlər yalandır,** (Allah-Təala Tövratda o sözləri nazil etməyib və Allaha yalan isnad etmək caiz deyildir. Sıradakı ayə Hz. İsanı özlərinə məbud sayan xristianların bu iddiasını rədd edir).

**79) (مَا كَانَ لِبَشَرٍ) - caiz deyil bir şəxsdən** (Hz. İsa) **ötrü ki, (أَنْ يُؤْتِيَهُ اللّٰهُ الْكِتَابَ وَالْحُكْمَ وَالنُّبُوَّةَ) - Allah-Təala ona kitab və hikmət verib onu xalqa peyğəmbər etsin, (ثُمَّ يَقُولَ لِلنَّاسِ) - bu şeyləri Allah-Təala ona verəndən sonra gəlib xalqa desin ki, (كُونُوا عِبَادًا لِي مِنْ دُونِ اللّٰهِ) - Allah-Təalanı tərk edib məni məbud bilib, Allah-Təalaya yox, mənə səcdə edin, ya da məni də Allah-Təalaya şərik sayın.** (Siz bu sözlərlə Hz. İsaya iftira və böhtan atırsınız, əslində, İsa belə sözlər deməyibdir). **(وَلَكِنْ كُونُوا رَبَّانِيِّينَ)** - (əksinə, Hz. İsa xalqa belə deyibdir:) **Allah-Təalanın dininə möhkəm yapışıb Ona itaət edin. (بِمَا كُنْتُمْ تُعَلِّمُونَ الْكِتَابَ) - o**

وَبِمَا كُنْتُمْ تَدْرُسُونَ ﴿٧٩﴾ وَلَا يَأْمُرَكُمْ أَنْ تَتَّخِذُوا الْمَلَائِكَةَ وَالنَّبِيِّينَ أَرْبَابًا أَيَأْمُرُكُمْ بِالْكُفْرِ بَعْدَ إِذْ
أَنْتُمْ مُسْلِمُونَ ﴿٨٠﴾ وَإِذْ أَخَذَ اللهُ مِيثَاقَ النَّبِيِّينَ لَمَا آتَيْتُكُمْ مِنْ كِتَابٍ وَحِكْمَةٍ ثُمَّ جَاءَكُمْ رَسُولٌ
مُصَدِّقٌ لِمَا مَعَكُمْ لَتُؤْمِنُنَّ بِهِ وَلَتَنْصُرُنَّهُ قَالَ أَأَقْرَرْتُمْ وَأَخَذْتُمْ عَلَى ذَلِكُمْ إِصْرِي قَالُوا أَقْرَرْنَا قَالَ
فَاشْهَدُوا وَأَنَا مَعَكُمْ مِنَ الشَّاهِدِينَ ﴿٨١﴾ فَمَنْ تَوَلَّى بَعْدَ ذَلِكَ فَأُولَئِكَ هُمُ الْفَاسِقُونَ ﴿٨٢﴾

---

**səbəbə görə ki, siz Tövrat və İncilin ehkamını bir-birinizə öyrədirsiniz, (وَبِمَا كُنْتُمْ تَدْرُسُونَ) - bir də o səbəbə görə ki, Allahın ehkamını oxuyub, bilməyən şəxslərə öyrədib, bir-birinizə təlim edirdiniz. Belə olan halda, əlbəttə, siz gərək Allah-Təalanın itaətində olasınız, budur, Hz. İsanın sözləri, nəinki desin ki, gəlin mənə ibadət edin.**

**80) (وَلَا يَأْمُرَكُمْ) – Hz. İsa sizə əmr etməz ki, (أَنْ تَتَّخِذُوا الْمَلَائِكَةَ وَالنَّبِيِّينَ أَرْبَابًا) - mələk və peyğəmbərləri özünüzə sahib və tərbiyə verən rəbb edəsiniz, əksinə, bütün məxluqatın rəbbi Allah-Təaladır. Necə ola bilər ki, Hz. İsa bunun xilafını sizə əmr etsin. (أَيَأْمُرُكُمْ بِالْكُفْرِ بَعْدَ إِذْ أَنْتُمْ مُسْلِمُونَ) – heç Hz. İsa Allah-Təalaya itaət edib iman gətirəndən sonra sizə kafir olmağı əmr edər? Heç vaxt o, belə əmr verməz.**

**81) (وَإِذْ أَخَذَ اللهُ) - ey əhli-kitab, yadınıza salın, o zaman ki Allah-Təala əhd aldı, (مِيثَاقَ النَّبِيِّينَ) – Hz. Musa və ondan sonra gələn peyğəmbərlərdən möhkəm olan əhd ki, gərək Allah-Təalanın ehkamını sizə yetirsinlər. (لَمَا آتَيْتُكُمْ مِنْ كِتَابٍ وَحِكْمَةٍ) - bu əhdi onlardan ona görə aldım ki, sizə kitab və hikmətdən nə vermişəmsə, onu sizə çatdırsınlar. (ثُمَّ جَاءَكُمْ رَسُولٌ)- o peyğəmbərlərdən sonra sizə bir peyğəmbər** (Hz. Məhəmməd) **gəldi, (مُصَدِّقٌ لِمَا مَعَكُمْ) -** (Hz. Məhəmməd) **sizə nazil olan kitabı** (Tövrat və İncili) **təsdiq edəndir, (لَتُؤْمِنُنَّ بِهِ وَلَتَنْصُرُنَّهُ) - əlbəttə, gərək Hz. Məhəmmədə iman gətirib ona kömək edəsiniz,** (bu qeyd olunan əhdi Allah-Təala peyğəmbərlərdən alandan sonra), **(قَالَ) - Allah-Təala peyğəmbərlərə buyurdu: "Ey peyğəmbərlər, (أَأَقْرَرْتُمْ) – bəs iqrar etdiniz ki, sizdən əhd aldım, (وَأَخَذْتُمْ عَلَى ذَلِكُمْ إِصْرِي) - və siz də bu iqrar etdiyinizə görə mənim möhkəm olan əhdimi aldınız,"** (Tövrat və İncilin ehkamına əməl etmək)**, yoxsa yox?) (قَالُوا أَقْرَرْنَا) –** (peyğəmbərlər) **dedilər: "İlahi, iqrar etdik". (قَالَ فَاشْهَدُوا) –** (Allah-Təala) **buyurdu: "Ey peyğəmbərlər, bu əhdi verdiyinizə bir-birinizə şahid olun. (وَأَنَا مَعَكُمْ مِنَ الشَّاهِدِينَ) - mən də sizinlə birlikdə şahidlərdənəm, heç vaxt qiyamət günündə bu əhdi inkar edə bilməzlər".** (Əhd ediblər ki, gərək Tövratın ehkamına əməl etsinlər, Tövratın ən böyük ehkamlarından biri Hz.Məhəmmədə iman gətirməkdir).

**82) (فَمَنْ تَوَلَّى بَعْدَ ذَلِكَ فَأُولَئِكَ هُمُ الْفَاسِقُونَ) – kim bu qeyd olunan sözü verəndən sonra üz döndərib Tövratın ehkamına əməl etməsə, əlbəttə, onlar fasiqdirlər .**

أَفَغَيْرَ دِينِ اللَّهِ يَبْغُونَ وَلَهُ أَسْلَمَ مَنْ فِي السَّمَاوَاتِ وَالْأَرْضِ طَوْعًا وَكَرْهًا وَإِلَيْهِ يُرْجَعُونَ ﴿٨٣﴾
قُلْ آمَنَّا بِاللَّهِ وَمَا أُنْزِلَ عَلَيْنَا وَمَا أُنْزِلَ عَلَى إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ وَإِسْحَاقَ وَيَعْقُوبَ وَالْأَسْبَاطِ
وَمَا أُوتِيَ مُوسَى وَعِيسَى وَالنَّبِيُّونَ مِنْ رَبِّهِمْ لَا نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِنْهُمْ وَنَحْنُ لَهُ مُسْلِمُونَ ﴿٨٤﴾
وَمَنْ يَبْتَغِ غَيْرَ الْإِسْلَامِ دِينًا فَلَنْ يُقْبَلَ مِنْهُ وَهُوَ فِي الْآخِرَةِ مِنَ الْخَاسِرِينَ ﴿٨٥﴾ كَيْفَ يَهْدِي
اللَّهُ قَوْمًا كَفَرُوا بَعْدَ إِيمَانِهِمْ

---

**83) (أَفَغَيْرَ دِينِ اللَّهِ يَبْغُونَ) – bəs əhli-kitab Allah-Təalanın dinindən başqa din istəyirlər? Allah-Təalanın kitabına əməl etməyənlər Onun dinindən kənardırlar. (وَلَهُ أَسْلَمَ مَنْ فِي السَّمَاوَاتِ وَالْأَرْضِ طَوْعًا وَكَرْهًا وَإِلَيْهِ يُرْجَعُونَ) - necə ola bilər ki, Allah-Təalanın dinindən başqa din istəsin? Halbuki səmalarda və yer üzündə olan məxluqat ya öz ixtiyarları ilə dəlil və sübut üzrə, ya da zorla Allah-Təalaya itaət ediblər,** (Necə ki itaət etməyənlərə bəla göndərdi, tamamən həlak olub Allah-Təalanın hökmündən çıxa bilmədilər ki, ölümdən xilas olsunlar)**, bütün məxluqat Allah-Təalanın tərəfinə qayıdacaqdır.**

**84) (قُلْ) –** (ey Məhəmməd)**, de ki, belə desinlər: (آمَنَّا بِاللَّهِ وَمَا أُنْزِلَ عَلَيْنَا) - "İman gətirdik Allah-Təalaya və o Qurana ki, onu bizə nazil edibdir. (və ma unzilə alə İbrahimə, İsmailə, İshaqə və Yaqubə vəl-əsbat) (وَمَا أُنْزِلَ عَلَى إِبْرَاهِيمَ وَإِسْمَاعِيلَ وَإِسْحَاقَ وَيَعْقُوبَ وَالْأَسْبَاطِ) - və iman gətirmişik o hökmlərə ki, Allah-Təaladan İbrahimə və İsmayıla və İshaqa və Yaquba və bir də Yaqubun nəslindən olan peyğəmbərlərə nazil olubdur, (وَمَا أُوتِيَ مُوسَى وَعِيسَى وَالنَّبِيُّونَ مِنْ رَبِّهِمْ) - və o kitablara ki Musaya və İsaya verilibdir, bütün peyğəmbərlərə öz rəbləri Allah-Təaladan nazil olan hökmlərə də iman gətirmişik. (لَا نُفَرِّقُ بَيْنَ أَحَدٍ مِنْهُمْ) - biz müsəlmanlar o peyğəmbərlərdən heç birinin arasında fərq qoymarıq, hamısına iman gətirmişik. (amma siz əhli-kitab fərq qoyursunuz, bəzi peyğəmbərlərə iman gətirib bəzisini inkar edirsiniz). (وَنَحْنُ لَهُ مُسْلِمُونَ) – Allah-Təalaya itaət edib ona şərik qoşmayan ancaq bizik.**

**85) (وَمَنْ يَبْتَغِ غَيْرَ الْإِسْلَامِ دِينًا فَلَنْ يُقْبَلَ مِنْهُ وَهُوَ فِي الْآخِرَةِ مِنَ الْخَاسِرِينَ) - kim islamdan başqa bir din axtarıb seçsə, o din heç vaxt o şəxsdən qəbul olunmayacaqdır və o şəxs axirətdə özünə zərər verənlərdən olub, ondan ötrü heç vaxt nicat olmaz.** (Məkkə əhlindən bir neçə nəfər, o cümlədən Tam`a ibn Übeyriq və Havh ibn Əslət, Haris ibn Süveyd və bunlardan başqa, bir neçə nəfər də Mədinəyə Hz. Peyğəmbərin hüzuruna gəlib müsəlman oldular, bir müddət sonra mürtəd olub Məkkəyə qayıtdılar. Onların arasından Haris yenidən tövbə edib islama daxil oldu, növbəti ayə onların barəsində nazil oldu)**.**

**86) (كَيْفَ يَهْدِي اللَّهُ قَوْمًا) - Allah-Təala o qövmü necə hidayət edər ki, (كَفَرُوا بَعْدَ إِيمَانِهِمْ) - iman gətirib islama daxil olandan sonra kafir oldu,** (necə ki

وَشَهِدُوا أَنَّ الرَّسُولَ حَقٌّ وَجَاءَهُمُ الْبَيِّنَاتُ وَاللهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ ﴿٨٦﴾ أُولَئِكَ جَزَاؤُهُمْ
أَنَّ عَلَيْهِمْ لَعْنَةَ اللهِ وَالْمَلَائِكَةِ وَالنَّاسِ أَجْمَعِينَ ﴿٨٧﴾ خَالِدِينَ فِيهَا لَا يُخَفَّفُ عَنْهُمُ الْعَذَابُ وَلَا
هُمْ يُنْظَرُونَ ﴿٨٨﴾ إِلَّا الَّذِينَ تَابُوا مِنْ بَعْدِ ذَلِكَ وَأَصْلَحُوا فَإِنَّ اللهَ غَفُورٌ رَحِيمٌ ﴿٨٩﴾ إِنَّ الَّذِينَ
كَفَرُوا بَعْدَ إِيمَانِهِمْ ثُمَّ ازْدَادُوا كُفْرًا لَنْ تُقْبَلَ تَوْبَتُهُمْ وَأُولَئِكَ هُمُ الضَّالُّونَ ﴿٩٠﴾

---

qeyd olundu), **(وَشَهِدُوا أَنَّ الرَّسُولَ حَقٌّ) - və şahidlik etdilər ki, Hz. Məhəmməd haqq olan peyğəmbərdir? (وَجَاءَهُمُ الْبَيِّنَاتُ) – halbuki islamın haqq olması haqqında aşkar olan dəlillər** (Qurani-Şərifin ayələri) **onlara gəlmişdi, belə olan halda yenə kafir olub mürtəd oldular. (وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ) - Allah-Təala zalım olan qövmü** (zülmə davam edib tövbə etməyənləri) **imana hidayət etməz.**

**87) (أُولَئِكَ جَزَاؤُهُمْ أَنَّ عَلَيْهِمْ لَعْنَةَ اللهِ وَالْمَلَائِكَةِ وَالنَّاسِ أَجْمَعِينَ) - o mürtəd olan şəxslərin cəzası odur ki, həqiqətən, Allah-Təalanın, bütün mələklərin və insanların lənəti onların üzərinə olar.**

**88) (خَالِدِينَ فِيهَا لَا يُخَفَّفُ عَنْهُمُ الْعَذَابُ وَلَا هُمْ يُنْظَرُونَ) - o mürtəd olan şəxslər həmişəlik Allah-Təalanın lənəti altında qalıb, cəhənnəm əzabı onlardan yüngülləşdirilməz, rəhmət nəzəri ilə də baxılmazlar.**

**89) (إِلَّا الَّذِينَ تَابُوا مِنْ بَعْدِ ذَلِكَ وَأَصْلَحُوا فَإِنَّ اللهَ غَفُورٌ رَحِيمٌ)- mürtəd olanlar heç vaxt əzabdan xilas olmazlar, ancaq o şəxslər ki kafir və mürtəd olandan sonra tövbə edib keçmiş əməllərini islah edərlər, belə halda, həqiqətən, Allah-Təala tövbəni qəbul edib, bəndələrinə rəhm edib onların günahlarını bağışlayandır.** (Necə ki Haris ibn Süveyd yenidən tövbə edib imana daxil oldu. "Təbsirə" adlı kitab Quranın bu açıq ayəsindən üz döndərib uydurma hədislərə əməl edən alimlərin dediklərini – "fitri" mürtədin tövbəsinin qəbul olunmayıb qətl edilməsi hökmünü rədd edir. Çünki ayənin ehtivası ümumidir, ayədə xüsusilik yoxdur, mürtəd milli olsun, ya da fitri*

*(*__Qeyd:__ Əgər bir müsəlman şəxs ata-babadan müsəlman olub özü islamdan çıxıb kafir olsa, ona fitri mürtəd deyilir və əgər qeyri-müsəlman bir şəxs islamı qəbul edəndən sonra dönüb yenidən öz dininə qayıtsa, ona milli mürtəd deyilir.* (Məhəmməd Kazım Yezdi, *Urvətul-Vusqa*, Təharət 1) *Tövbənin qəbul olunması mehriban olan Allah-Təalanın öz bəndələrinə bir rəhmət və əfv qapısıdır ki, həmişə asi bəndələrinin üzünə açıqdır).*

**90) (إِنَّ الَّذِينَ كَفَرُوا بَعْدَ إِيمَانِهِمْ) - həqiqətən, iman gətirəndən sonra kafir olanlar, (ثُمَّ ازْدَادُوا كُفْرًا) - kafir olandan sonra da ölüm onlara gəlincəyə qədər küfrdə sabit qalıb ancaq o zaman tövbə etsələr, (لَنْ تُقْبَلَ تَوْبَتُهُمْ) – ölüm vaxtı heç vaxt onların tövbəsi qəbul olunmaz. (وَأُولَئِكَ هُمُ الضَّالُّونَ) - əlbəttə ki, asi olub haqq yoldan kənara çıxanlar onlardır.**

إِنَّ الَّذِينَ كَفَرُوا وَمَاتُوا وَهُمْ كُفَّارٌ فَلَنْ يُقْبَلَ مِنْ أَحَدِهِمْ مِلْءُ الْأَرْضِ ذَهَبًا وَلَوِ افْتَدَى بِهِ أُولَئِكَ
لَهُمْ عَذَابٌ أَلِيمٌ وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ ﴿٩١﴾ لَنْ تَنَالُوا الْبِرَّ حَتَّى تُنْفِقُوا مِمَّا تُحِبُّونَ وَمَا تُنْفِقُوا مِنْ
شَيْءٍ فَإِنَّ اللَّهَ بِهِ عَلِيمٌ ﴿٩٢﴾

---

**91) (إِنَّ الَّذِينَ كَفَرُوا) - həqiqətən, kafir olanlar, (وَمَاتُوا وَهُمْ كُفَّارٌ) – və küfr halında ikən ölənlər, (فَلَنْ يُقْبَلَ مِنْ أَحَدِهِمْ) - heç vaxt onların heç birindən** (verdikləri) **qəbul olunmaz, (مِلْءُ الْأَرْضِ ذَهَبًا وَلَوِ افْتَدَى بِهِ) - hətta dünya dolusu qızıl versələr də ki bəlkə, onun səbəbinə əzabdan xilas olsunlar, əsla əzabdan xilas olmazlar. (أُولَئِكَ لَهُمْ عَذَابٌ أَلِيمٌ) - əlbəttə ki, onlardan ötrü çox şiddətli əzab vardır. (وَمَا لَهُمْ مِنْ نَاصِرِينَ) - onlara bir kömək edən də olmaz ki, ilahi əzabdan xilas olsunlar.**

**92) (لَنْ تَنَالُوا الْبِرَّ حَتَّى تُنْفِقُوا مِمَّا تُحِبُّونَ وَمَا تُنْفِقُوا مِنْ شَيْءٍ فَإِنَّ اللَّهَ بِهِ عَلِيمٌ) - həqiqətən*, sevdiyiniz şeylərdən Allah-Təala yolunda keçib sədəqə və ehsan vermədikcə, onun əcr, savabına çatmazsınız. Həqiqətən, Allah-Təala ondan agahdır, onun qarşılığını sizə yetirəcəkdir.** (Tövratda yəhudi camaatına bir çox şeylər haram olubdur ki, o şeylər islamda haram olmayıbdır. O cümlədən öküzün, qoyunun piyləri və damarları onlara haramdır. Onların haram olmasına yəhudilərin öz zülmləri səbəb oldu. Müsəlmanlar yəhudilərə məzəmmət edib deyirdilər: "Bunların haram olmasına siz özünüz bais oldunuz. Sizdən əvvəl o şeylər haram deyildi". Onlar inkar edib dedilər: "Bu şeylər Yaqub zamanından bəri haramdır. Allah-Təala onların iddiasını rədd etmək üçün sıradakı ayəni nazil buyurdu").

*(****Qeyd:*** Bu ayə zəngin şəxslərə xitabdır, yəni ey zənginlər, gərək, çox sevdiyiniz mallarınızı din və məzhəbin tərəqqisi, ümmətin övladlarının ehtiyaclarının həll edilməsi üçün sərf edəsiniz, necə ki Mədinə əhli olan ənsar mallarından və canlarından keçdilər ki, islam rəvac tapsın. Zəngin şəxs zamanın şərtinə görə, gərək, malını ümmət övladlarının və dinin tərəqqisi üçün sərf etsin. Nəinki malını öz düşmənindən ötrü yığıb qoyub getsin. Şeyx Nizami Gəncəvi necə də gözəl deyir:*

*Hər nəyi ki, sən sevirsən, ölümün çatdığı zaman*
*Ən qatı düşməninə qoyub gedəcəksən.*

*Zənginlərin məqam və mərtəbələri nə böyük məqam və mərtəbədir, Allah-Təala Qurani-Şərifdə uca peyğəmbərinin möcüzəli bəyanı ilə sırf onlara xitab edib onlar haqqında fərman verir. Əgər zənginlər bu xitabın həqiqətinə agah olub ona qədir-qiymət qoysalar, nəinki mallarından, bəlkə, bunun müqabilində əziz olan canlarından da, gərək, keçsinlər. Amma vay olsun o zənginlərə ki, bu xitabın ehtivasından özlərini kənar edib, dünya malını yığıb, özləri dünyadan köçəndən sonra onun naxələf varisləri bu malı günah və haram işlərdə sərf edib, onun günah və əzabını da o məlunun xəbis, xəsis ruhuna hədiyyə edirlər. Belə zənginlərə ar olsun).*

كُلُّ الطَّعَامِ كَانَ حِلًّا لِبَنِي إِسْرَائِيلَ إِلَّا مَا حَرَّمَ إِسْرَائِيلُ عَلَى نَفْسِهِ مِنْ قَبْلِ أَنْ تُنَزَّلَ التَّوْرَاةُ قُلْ
فَأْتُوا بِالتَّوْرَاةِ فَاتْلُوهَا إِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٩٣﴾ فَمَنِ افْتَرَى عَلَى اللهِ الْكَذِبَ مِنْ بَعْدِ ذَلِكَ فَأُولَئِكَ
هُمُ الظَّالِمُونَ ﴿٩٤﴾ قُلْ صَدَقَ اللهُ فَاتَّبِعُوا مِلَّةَ إِبْرَاهِيمَ حَنِيفًا وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ ﴿٩٥﴾ إِنَّ
أَوَّلَ بَيْتٍ وُضِعَ لِلنَّاسِ لَلَّذِي بِبَكَّةَ مُبَارَكًا وَهُدًى لِلْعَالَمِينَ ﴿٩٦﴾

---

**93) (كُلُّ الطَّعَامِ كَانَ حِلًّا لِبَنِي إِسْرَائِيلَ) – bütün yeməklər bəni-İsrailə halal idi. (إِلَّا مَا حَرَّمَ إِسْرَائِيلُ عَلَى نَفْسِهِ مِنْ قَبْلِ أَنْ تُنَزَّلَ التَّوْرَاةُ) - ancaq o yeməkdən başqa ki, Tövrat nazil olmaqdan qabaq Yaqub onu özü-özünə haram etmişdi.** (Dəvənin ətini və südünü Yaqub özünə haram etmişdi, bu haram Allah-Təalanın haramı deyil idi ki, bəni-İsrail belə deyirdi: “Bu şeyləri Allah-Təala Yaqub zamanında haram edib, ondan ötrü ki, Yaqub naxoş olanda nəzir etdi ki, əgər naxoşluqdan şəfa tapsa sevdiyi yeməkləri özünə haram etsin. Elə ki şəfa tapdı, çox sevdiyi dəvə əti ilə südünü özünə haram etdi. Sonra Allah-Təala onun bu hərəkətinə müvafiq olaraq bəni-İsrailin zülmünə görə, Tövratda dəvənin ətini və ondan başqa bəzi şeyləri onlara haram etdi). **(قُلْ فَأْتُوا بِالتَّوْرَاةِ فَاتْلُوهَا) –** (ey Məhəmməd), **de ki, Tövratı götürüb oxuyun, görək Tövratda nə kimi xəbərlər verilibdir. Bəs bu şeyləri Allah-Təala sizə haram edib, yoxsa sizdən qabaq Yaquba haram edib? (إِنْ كُنْتُمْ صَادِقِينَ) - əgər doğru deyənsinizsə, gərək, Tövratı gətirəsiniz. Doğru deyən şəxsin əlində dəlil və sübut olar.**

**94) (فَمَنِ افْتَرَى عَلَى اللهِ الْكَذِبَ مِنْ بَعْدِ ذَلِكَ فَأُولَئِكَ هُمُ الظَّالِمُونَ) – kim iftira edib Allah-Təalaya yalan isnad etsə, əlbəttə, zalım olan onlardır, necə ki bəni-İsrail iftira edib Allah-Təalaya yalan isnad edib dedilər: “Allah-Təala bu şeyləri Tövratdan qabaq haram buyurubdur”.**

**95) (قُلْ صَدَقَ اللهُ فَاتَّبِعُوا مِلَّةَ إِبْرَاهِيمَ حَنِيفًا وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ) –** (ey Məhəmməd), **yəhudilərə de ki, Allah-Təala bunda düz deyəndir ki, sizin zülmünüzə görə, Tövratda o şeyləri sizə haram edibdir, sizdən əvvəl haram etməyibdir, siz isə deyirsiniz ki, bizdən əvvəl bu şeylər haram olubdur, yalançısınız. Gəlin İbrahimin dininə - islama tabe olun ki, islamda o şeylər halaldır, o zaman məşəqqətdən xilas olarsınız. İbrahim batildən haqq tərəfinə meyil edən müşriklərdən deyildi. Amma siz yəhudilər Allah-Təalaya şərik qoşub Üzeyri Allah-Təalanın oğlu sayırsınız).**

**96) (إِنَّ أَوَّلَ بَيْتٍ وُضِعَ لِلنَّاسِ لَلَّذِي بِبَكَّةَ مُبَارَكًا وَهُدًى لِلْعَالَمِينَ) -** (bu ayədə yəhudiləri islama təşviq edib buyurur:) **həqiqətən, Allah-Təala tərəfindən xalqın tavaf etməsi üçün tikilməsinə hökm edilən ilk ev Məkkə şəhərindədir.** (Məkkə şəhərinə Bəkkə də deyilir. Onu siz yəhudilərin babası Hz. İbrahim tikibdir. İslam dini Hz. İbrahimin dinidir. Bəs nəyə görə islam dininə daxil olmursunuz?)

فِيهِ آيَاتٌ بَيِّنَاتٌ مَقَامُ إِبْرَاهِيمَ وَمَنْ دَخَلَهُ كَانَ آمِنًا وَلِلَّهِ عَلَى النَّاسِ حِجُّ الْبَيْتِ مَنِ اسْتَطَاعَ إِلَيْهِ سَبِيلًا وَمَنْ كَفَرَ فَإِنَّ اللَّهَ غَنِيٌّ عَنِ الْعَالَمِينَ ﴿٩٧﴾ قُلْ يَا أَهْلَ الْكِتَابِ لِمَ تَكْفُرُونَ بِآيَاتِ اللَّهِ وَاللَّهُ شَهِيدٌ عَلَى مَا تَعْمَلُونَ ﴿٩٨﴾ قُلْ يَا أَهْلَ الْكِتَابِ لِمَ تَصُدُّونَ عَنْ سَبِيلِ اللَّهِ مَنْ آمَنَ تَبْغُونَهَا عِوَجًا وَأَنْتُمْ شُهَدَاءُ وَمَا اللَّهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ ﴿٩٩﴾

---

**97) (فِيهِ آيَاتٌ بَيِّنَاتٌ مَقَامُ إِبْرَاهِيمَ) - o Kəbədə Allah-Təalanın tövhidinə açıq-aşkar olan dəlillər və İbrahimin ibadət etdiyi məqam - yer vardır.** (Məqami-İbrahimin təfsilatı Bəqərə surəsində 126-cı ayədə qeyd olundu). **(وَمَنْ دَخَلَهُ كَانَ آمِنًا) - Kəbəyə daxil olan hər kəs gərək hər bir cəhətdən əmin-amanlıqda olsun. (**Əgər günahkardırsa, tövbə edib Allah-Təalanın əzabından əmin-amanlıqda olar və əgər dünyada bir xəta edibsə, hansı ki, gərək, ona şəriət cəzası verilsin, o vaxt gəlib Kəbəyə daxil olsa, o şəxs Kəbədə əmin-amanlıqda olar. Heç bir şəxs onu zorla oradan çıxara bilməz. Amma yemək və içmək verməzlər ki, özü oradan çıxsın. Çıxandan sonra onu tutub cəzasını verərlər). **(وَلِلَّهِ عَلَى النَّاسِ حِجُّ الْبَيْتِ مَنِ اسْتَطَاعَ إِلَيْهِ سَبِيلًا) - İnsanların Allah-Təaladan ötrü həccə gedib Kəbəni ziyarət etməsi vacibdir. O şəxslərə vacibdir ki, yolu gedib-gəlmək imkanına qadir olsunlar.** (Kim Məkkəyə gedib-qayıtmaq imkanına qadir oldu, Məkkəyə gedib Kəbəni ziyarət etmək ona vacibdir. Həccin vacib olmasının dəlili bu ayədir). **(وَمَنْ كَفَرَ) - kim imkanı olduğu halda, həccə getməyib Allah-Təalanı inkar etsə, (فَإِنَّ اللَّهَ غَنِيٌّ عَنِ الْعَالَمِينَ) - Allah-Təalanın belə şəxslərə ehtiyacı yoxdur. Həqiqətən, Allah-Təala bütün aləmlərdən ehtiyacsızdır.** (Bu ayə buna işarə edir ki, kim imkanı olduğu halda, həccə getməyi tərk etsə, o şəxs kafir hökmündədir).

**98) (قُلْ يَا أَهْلَ الْكِتَابِ لِمَ تَكْفُرُونَ بِآيَاتِ اللَّهِ وَاللَّهُ شَهِيدٌ عَلَى مَا تَعْمَلُونَ) –** (ey Məhəmməd)**, de ki, ey əhli-kitab, niyə mənim haqq olmağıma işarə edən möcüzələri** (Quran ayələrini) **inkar edirsiniz, halbuki Allah-Təala sizin əməllərinizə şahiddir, ona görə sizə əzab verəcəkdir.**

**99) (قُلْ يَا أَهْلَ الْكِتَابِ) -** (ey Məhəmməd)**, de ki, ey əhli-kitab, (لِمَ تَصُدُّونَ عَنْ سَبِيلِ اللَّهِ مَنْ آمَنَ) - o şəxslər ki Qurana iman gətirmək istəyirlər, niyə onları Allah-Təala yolundan və islama daxil olmaqdan saxlayıb mane olursunuz?** (Yəhudilər iman gətirən, ya imana daxil olmaq istəyən şəxslərə mane olub geri qaytarmağa səy edirdilər). **(تَبْغُونَهَا عِوَجًا) – haqq din olan islamdan ötrü eyib və nöqsan axtarırsınız ki, xalqa islamda heç bir düzlük olmadığını göstərəsiniz? (وَأَنْتُمْ شُهَدَاءُ) - halbuki siz əhli-kitab şahidsiniz ki, islam dini haqq olan din və Allah-Təalanın düz olan yoludur. Siz əhli-kitab olduğunuz üçün öz kitabınızdan bu islamın haqq din olması sizə məlumdur. Lakin gizlədib məxfi saxlayırsınız. (وَمَا اللَّهُ بِغَافِلٍ عَمَّا تَعْمَلُونَ) - Allah-Təala etdiyiniz əməllərdən qafil deyildir.** (Bir gün ənsar - Evs* və Xəzrəc əhli

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِنْ تُطِيعُوا فَرِيقًا مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ يَرُدُّوكُمْ بَعْدَ إِيمَانِكُمْ كَافِرِينَ ﴿١٠٠﴾
وَكَيْفَ تَكْفُرُونَ وَأَنْتُمْ تُتْلَى عَلَيْكُمْ آيَاتُ اللهِ وَفِيكُمْ رَسُولُهُ وَمَنْ يَعْتَصِمْ بِاللهِ فَقَدْ هُدِيَ إِلَى صِرَاطٍ
مُسْتَقِيمٍ ﴿١٠١﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللهَ حَقَّ تُقَاتِهِ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنْتُمْ مُسْلِمُونَ ﴿١٠٢﴾

---

Mədinədə bir yerə yığılıb söhbətlə məşğul idilər. Yəhudilərdən bir nəfər - müsəlmanlara böyük düşmən hesab olunan Şəmmas ibn Qeys oradan keçirdi, baxıb gördü ki, həmişə bir-birilərinin qanını tökən Evs və Xəzrəc indi islamın bərəkətindən bir-biriləri ilə qardaş kimi söhbət edirlər. Bu mətləb ona ağır gəldi, yəhudilərin cavanlarından bir nəfəri çağırıb dedi: "Get ənsarın yanına, onların cahiliyyə zamanında aralarında vaqe olan savaşlarını onların yadına sal, o savaşlarda deyilən şeirlərdən oxu". O cavan yəhudi gəlib onların yanında Buas davasının şeirlərindən oxuyanda ənsar bu sözlərdən qəzəbləndi, aralarında dava-dalaş başladı. Hz. Peyğəmbər bundan xəbərdar olub gəldi, onları məzəmmət etməyə başladı və buyurdu: "Ey ənsar camaatı, Allah-Təala sizi islama hidayət edib, şirk və nifaqı sizdən götürəndən sonra mən peyğəmbər də sizin aranızda cahiliyyə işlərinə yenə ola-ola, başlayırsınız?"

*(*****Qeyd:** Evs və Xəzrəc Mədinədə iki böyük tayfa idi).*

*(*****Qeyd:** Buas bir savaşdır, Mədinə əhli (Evs və Xəzrəc) arasında peyğəmbərdən qabaq vaqe olub, o savaşda Evs Xəzrəc camaatına qalib gəlmişdi).*

Hz. Peyğəmbərin bu nəsihətindən ənsar əhli sakitləşib, bir-biriləri ilə qucaqlaşıb, ağlayıb ayrıldılar. O zaman bu ayə nazil oldu).

**100) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) - ey iman gətirən ənsar əhli, (إِنْ تُطِيعُوا فَرِيقًا مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ) - əgər kitab** (Tövrat) **verilən şəxslərə** (yəhudilərə) **itaət etsəniz, (يَرُدُّوكُمْ بَعْدَ إِيمَانِكُمْ كَافِرِينَ) - islama daxil olub iman gətirəndən sonra sizi islamdan geri qaytarıb kafir edərlər.**

**101) (وَكَيْفَ تَكْفُرُونَ) - ey ənsar əhli, islama daxil olandan sonra necə kafir olarsınız? (وَأَنْتُمْ تُتْلَى عَلَيْكُمْ آيَاتُ اللهِ) - halbuki Allah-Təalanın ayələri – Qurani-Şərifin kəlmələri sizə oxunur, necə ola bilər ki, kimsə Qurani-Şərifin ayələrini eşidib dərk edəndən sonra onu inkar etsin? (وَفِيكُمْ رَسُولُهُ) - necə ola bilər ki, siz kafir olasınız? Halbuki sizin aranızda Allah-Təalanın peyğəmbəri** (Hz. Məhəmməd) **vardır. (وَمَنْ يَعْتَصِمْ بِاللهِ) - kim Allah-Təalanın dininə bağlansa, (فَقَدْ هُدِيَ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ) - həqiqətən, o şəxs düz və haqq olan yolun tərəfinə** (islama) **hidayət olunubdur.**

**102) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللهَ حَقَّ تُقَاتِهِ وَلَا تَمُوتُنَّ إِلَّا وَأَنْتُمْ مُسْلِمُونَ) - ey iman gətirən ənsar əhli, Allah-Təaladan haqq və təqva ilə qorxun.** (Vacib əmrləri edib haramı tərk edin)**, əlbəttə, ölüm sizə gələndə gərək islam üzrə ölüb, dünyadan elə gedəsiniz.**

وَاعْتَصِمُوا بِحَبْلِ اللَّهِ جَمِيعًا وَلَا تَفَرَّقُوا وَاذْكُرُوا نِعْمَةَ اللَّهِ عَلَيْكُمْ إِذْ كُنْتُمْ أَعْدَاءً فَأَلَّفَ بَيْنَ قُلُوبِكُمْ
فَأَصْبَحْتُمْ بِنِعْمَتِهِ إِخْوَانًا وَكُنْتُمْ عَلَى شَفَا حُفْرَةٍ مِنَ النَّارِ فَأَنْقَذَكُمْ مِنْهَا كَذَلِكَ يُبَيِّنُ اللَّهُ لَكُمْ آيَاتِهِ
لَعَلَّكُمْ تَهْتَدُونَ ﴿١٠٣﴾ وَلْتَكُنْ مِنْكُمْ أُمَّةٌ

---

**103) (وَاعْتَصِمُوا بِحَبْلِ اللَّهِ جَمِيعًا) - hamınız Allah-Təalanın ipinə** (islama) **möhkəm yapışın, (وَلَا تَفَرَّقُوا) - islama daxil olandan sonra ayrılıb dağılmayın, (وَاذْكُرُوا نِعْمَةَ اللَّهِ عَلَيْكُمْ) - ey ənsar əhli, Allah-Təalanın sizə verdiyi nemətlərini yadınıza salın. (إِذْ كُنْتُمْ أَعْدَاءً فَأَلَّفَ بَيْنَ قُلُوبِكُمْ) -** (o nemət budur ki, siz Mədinə əhli (ənsar) bir-biri ilə düşmən idiniz, Evs və Xəzrəc arasında 120 ildən bəri qovğa və ədavət var idi, Hz. Peyğəmbərin sayəsində onların arasından ədavət götürülüb bir-biriləri ilə dost oldular). **Allah-Təala islam sayəsində qəlblərinizi birləşdirib nifaqı sizdən götürdü. (فَأَصْبَحْتُمْ بِنِعْمَتِهِ إِخْوَانًا) - Allah-Təalanın neməti** (islam) **sayəsində bir-birinizlə qardaş oldunuz. (وَكُنْتُمْ عَلَى شَفَا حُفْرَةٍ مِنَ النَّارِ) - siz Mədinə əhli küfr səbəbinə, sanki, cəhənnəm odunun kənarında idiniz. Az qalmışdı ki, o oda düşəsiniz. (فَأَنْقَذَكُمْ مِنْهَا) - Allah-Təala islam sayəsində sizi cəhənnəm odundan xilas etdi. (كَذَلِكَ) - necə ki qeyd olundu, (يُبَيِّنُ اللَّهُ لَكُمْ آيَاتِهِ)- Allah-Təala sizdən ötrü islamın haqq olması üçün o dəlil və sübutunu bəyan edir. (لَعَلَّكُمْ تَهْتَدُونَ) - əlbəttə, gərək, siz də Haqq tərəfinə hidayət tapan olasınız,** (ənsar haqqında nazil olan ayələr tamam oldu). Sıradakı ayə Qurana iman gətirən müsəlmanlara xitabdır).

**104) (وَلْتَكُنْ مِنْكُمْ أُمَّةٌ) - əlbəttə, gərək, * siz müsəlmanlardan bir qrup elm sahibi olsun.**

*(***Qeyd:** Xeyiri əmr, şəri qadağan etmək islamın ən böyük əsasıdır. "Minbərdə olduğu zaman Hz. Peyğəmbərdən soruşdular: "Ey Peyğəmbər, məxluqatın hansı yaxşıdır?" Buyurdu: "Xeyiri əmr, şəri qadağan edən şəxslər," ondan sonra buyurdu: "Kim xeyiri əmr, şəri qadağa etsə, o şəxs yer üzündə Allah-Təalanın və onun peyğəmbərinin vəkilidir". Dini ehkamlara agah olan şəxs, gərək, xeyiri əmr, şəri qadağan etsin. İslamda haqq olan sözləri gizlətməyib desin. Kim adını alim qoyub Quranın aşkar və gözəl olan ehkamını və peyğəmbərin buyurduğu haqq sözləri gizlədib xalqa deməsə, ya da onların xilafını desə, o şəxs islamın düşmənidir. Müsəlmanların onu öz aralarından qovması lazımdır. Amma islam ümməti arasında cəhalət geniş yayıldığından pisəyaxşıya fərq qoyulmayıb, xalq Allah-Təalanın evi olan məscidlərdə minbərdə əyləşən bəzi meymun sifətli din və ümmət düşmənlərindən Qurana zidd olan sözləri eşidib, onu ilahi hökm zənn edib cani-dildən o sözlərə talib olurlar. Din düşmənlərinin pis-yaxşı sözlərinə fərq qoymaq üçün elm lazımdır. Elm olmasa, heyvan təbiətli avam xalq onların məkr və hiylələrinə, oyunbazlığına agah ola bilməzlər, necə ki Allah-Təalanın kitabını təhrif edib peyğəmbərə iftira atanlar yalan hədisləri və peyğəmbərin əhli-beytinə verdikləri yalan nisbətləri, varid olan müsibətləri özlərindən ötrü ticarət sərmayəsi ediblər, min cür hiylə və məkr ilə, uydurma xəbərlər və iftiralar ilə cahil olan məxluqatı özlərinə ram və müti edirlər. (Bir nəfər arif şəxs deyir: "Əgər alim bir şəxsin hamı*

يَدْعُونَ إِلَى الْخَيْرِ وَيَأْمُرُونَ بِالْمَعْرُوفِ وَيَنْهَوْنَ عَنِ الْمُنْكَرِ وَأُولَئِكَ هُمُ الْمُفْلِحُونَ ﴿١٠٤﴾ وَلَا
تَكُونُوا كَالَّذِينَ تَفَرَّقُوا وَاخْتَلَفُوا مِنْ بَعْدِ مَا جَاءَهُمُ الْبَيِّنَاتُ وَأُولَئِكَ لَهُمْ عَذَابٌ عَظِيمٌ ﴿١٠٥﴾
يَوْمَ تَبْيَضُّ وُجُوهٌ وَتَسْوَدُّ وُجُوهٌ

---

*tərəfindən sevildiyini və heç kimin onun haqqında pis söz demədiyini görsəniz, bilin ki, o hiyləbaz və riyakar şəxsdir. Xalqın istəyinə müvafiq söz danışır. Amma Allah-Təaladan ötrü haqq söz danışan şəxs xalq tərəfindən sevilməyib onu düşmən sayarlar. Buna görə də müsəlmanlara elm lazımdır ki, haqqı batildən ayırıb din və məzhəb düşmənlərinin dolaşıq yollarına, meymun hiyləsindən betər olan məkr və hiylələrindən xəbərdar olsunlar”.)*

**(يَدْعُونَ إِلَى الْخَيْرِ) - onlar xalqı xeyir əmələ tərəf çağırıb dəvət etsinlər. (وَيَأْمُرُونَ بِالْمَعْرُوفِ) – xalqa şəriəti - islamda yaxşı olan əməlləri əmr edib, (وَيَنْهَوْنَ عَنِ الْمُنْكَرِ) - pis əməlləri qadağan etsinlər. (وَأُولَئِكَ هُمُ الْمُفْلِحُونَ) – əlbəttə, bunlar nicat tapan şəxslərdir.**

**105) (وَلَا تَكُونُوا) - siz* müsəlmanlar, olmayın, (كَالَّذِينَ تَفَرَّقُوا وَاخْتَلَفُوا) - o şəxslər** (yəhudi, xristian) **kimi hansı ki öz dinlərində ixtilaf edib parçalandılar, (مِنْ بَعْدِ مَا جَاءَهُمُ الْبَيِّنَاتُ) - ittifaq və ittihad barəsində aşkar olan dəlillər onlara gələndən sonra, (وَأُولَئِكَ لَهُمْ عَذَابٌ عَظِيمٌ) - o ixtilaf edən əhli-kitabdan ötrü Allah-Təala qatında böyük əzab vardır.**

*(****Qeyd:** “Ey islam əhli, insafla bu ayəyə baxın ki, necə açıq-aşkar şəkildə islamda ixtilaf etməyi bizə qadağan edir. Ey İslam camaatı, bəs bu ayəyə biz əməl edirik? Əgər əməl etsəydik, müsəlmanlar arasında bu qədər ixtilaf olmazdı, hansı millətin arasında müsəlmanlarda olan qədər təfriqə və ixtilaf var? İslam ümmətinin zəifləməsinə və təfriqəsinə bais olan həmin ixtilafdır. Başqa millətlərin dinlərində ixtilaf olsa da, başqa millətlərə qarşı birlik içində olarlar. Amma islam ümmətinin içində olan nifaq, müsəlmanların bir-birilərinə qarşı olan həsəd və ədavətləri onları günbəgün zəiflədib, başqa millətlərin nəzərlərində həqir və zəlil edibdir. Heyif olsun, Qurani-Şərifin gözəl nəsihətlərini başqa millətlər qəbul edib, gündən-günə tərəqqi ediblər. Amma biz müsəlmanlar Qurandan üz çevirib, əsli olmayan yalan sözlərə inanıb, parşa-parça olub, müsəlman adından başqa hərəmiz bir ad götürüb, zəlil və məhv olmuşuq. Bu pərişan olan ümmətə zəmanəyə uyğun mərifətli tərbiyəçilər lazımdır ki, xalqa hikmət üzrə siyasi və dini rəhbərlik edib cəhalət dərdinə düçar olanlarımızın xəstəliyini təyin edib, müalicə etsinlər. Lakin indi tərbiyəçilərin özlərinin tərbiyəyə ehtiyacları olduğu halda, necə tərbiyə verə bilərlər?*

*İlahi, nə yaman zəmanəyə düçar olduq? Bununla belə, gərək, qafil olmayaq, ümiddən möhkəm yapışıb ağılla cəhd və qeyrət göstərib elm nuruna tərəf baxaq, o nur hardan gəlirsə, üzüüstə də olsa, tez o tərəfə sürünüb imkan nisbətində elm nurundan istifadə etmək lazımdır).*

**106) (يَوْمَ تَبْيَضُّ وُجُوهٌ) - yadınıza salın o günü ki,** (qiyamət günü) **o gündə bəzi üzlər** (möminlərin üzləri) **ağarar, (وَتَسْوَدُّ وُجُوهٌ) - bəzi üzlər** (kafir və

**فَأَمَّا الَّذِينَ اسْوَدَّتْ وُجُوهُهُمْ أَكَفَرْتُم بَعْدَ إِيمَانِكُمْ فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ ﴿١٠٦﴾ وَأَمَّا**
**الَّذِينَ ابْيَضَّتْ وُجُوهُهُمْ فَفِي رَحْمَةِ اللهِ هُمْ فِيهَا خَالِدُونَ ﴿١٠٧﴾ تِلْكَ آيَاتُ اللهِ نَتْلُوهَا عَلَيْكَ**
**بِالْحَقِّ وَمَا اللهُ يُرِيدُ ظُلْمًا لِلْعَالَمِينَ ﴿١٠٨﴾ وَلِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ وَإِلَى اللهِ تُرْجَعُ**
**الْأُمُورُ ﴿١٠٩﴾ كُنْتُمْ خَيْرَ أُمَّةٍ أُخْرِجَتْ لِلنَّاسِ تَأْمُرُونَ بِالْمَعْرُوفِ وَتَنْهَوْنَ عَنِ الْمُنْكَرِ وَتُؤْمِنُونَ**
**بِاللهِ وَلَوْ آمَنَ أَهْلُ الْكِتَابِ لَكَانَ خَيْرًا لَهُمْ مِنْهُمُ الْمُؤْمِنُونَ وَأَكْثَرُهُمُ الْفَاسِقُونَ ﴿١١٠﴾**

---

münafiqlərin üzləri) **qaralar, (فَأَمَّا الَّذِينَ اسْوَدَّتْ وُجُوهُهُمْ) - amma o şəxslər ki onların üzləri qaralar, (أَكَفَرْتُم بَعْدَ إِيمَانِكُمْ) - onlara deyilər: "Bəs Tövrat, İncil və Qurana iman gətirəndən sonra kafir oldunuz?" Onlar cavab verə bilməzlər. Allah-Təala yenidən buyurar: (فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ) - "Allah-Təalanın kitablarını və peyğəmbərlərini inkar etdiyiniz üçün, indi cəhənnəm əzabını dadın".**

**107) (وَأَمَّا الَّذِينَ ابْيَضَّتْ وُجُوهُهُمْ فَفِي رَحْمَةِ اللهِ هُمْ فِيهَا خَالِدُونَ) - amma o şəxslər ki qiyamət günündə onların üzləri ağarar, onlar Allah-Təalanın rəhmətinə daxil olub orada həmişəlik qalıb çıxmazlar.**

**108) (تِلْكَ آيَاتُ اللهِ نَتْلُوهَا عَلَيْكَ بِالْحَقِّ وَمَا اللهُ يُرِيدُ ظُلْمًا لِلْعَالَمِينَ) –** (ey Məhəmməd), **bunlar əzab və savab barəsində Allah-Təalanın ayələridir. Onları haqqıyla sənə oxuyub təlim edirik. Allah-Təala aləmlərə zülm diləyən deyildir. Hər bir şəxs özü-özünə zülm edəndir.**

**109) (وَلِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ وَإِلَى اللهِ تُرْجَعُ الْأُمُورُ) - səmalarda və yerdə olan hər şey Allah-Təalanın ixtiyarındadır. Və bütün işlər Allah-Təalanın tərəfinə qayıdacaqdır. Savab və cəza Allah-Təalanın qüdrətindədir.** (Sıradakı ayə Hz. Peyğəmbərin səhabələrinə xitabdır. Hansı ki xalqı islama dəvət edib xeyiri əmr, şəri qadağan edirdilər).

**110) (كُنْتُمْ خَيْرَ أُمَّةٍ) -** (ey Hz. Məhəmmədin) **səhabələri, siz bu ümmətin ən yaxşılarısınız. (أُخْرِجَتْ لِلنَّاسِ) - Allah-Təala sizi xalqın hidayətindən ötrü meydana gətiribdir. (تَأْمُرُونَ بِالْمَعْرُوفِ) - sizin yaxşı olmağınız o səbəbə görədir ki, xalqa tövhidi və islamda gözəl olan əməlləri əmr edirsiniz. (وَتَنْهَوْنَ عَنِ الْمُنْكَرِ) - şirki, islam şəriətində pis və xəbis sayılan əməlləri qadağan edirsiniz. (وَتُؤْمِنُونَ بِاللهِ) - haqq olan Allah-Təalaya iman gətirirsiniz, (وَلَوْ آمَنَ أَهْلُ الْكِتَابِ) - əgər əhli-kitab da sizin kimi islama iman gətirsələr, (لَكَانَ خَيْرًا لَهُمْ) - əlbəttə, bu iman gətirmək onlardan ötrü öz dinlərində qalmaqdan yaxşıdır. (مِنْهُمُ الْمُؤْمِنُونَ) - əhli-kitabdan** (yəhudilərdən) **bəzi iman gətirən şəxslər (Abdullah* ibn Salam və onun yoldaşları) vardır, (وَأَكْثَرُهُمُ الْفَاسِقُونَ) - amma yəhudilərin əksəriyyəti küfr və inadlarında qalıb israr edəndirlər.**

*(****Qeyd:*** Mədinədə olan yəhudilərdən müsəlman olan ilk şəxs Abdullah ibn Salam və onun yoldaşlarıdır).*

لَنْ يَضُرُّوكُمْ إِلَّا أَذًى وَإِنْ يُقَاتِلُوكُمْ يُوَلُّوكُمُ الْأَدْبَارَ ثُمَّ لَا يُنْصَرُونَ ﴿١١١﴾ ضُرِبَتْ عَلَيْهِمُ الذِّلَّةُ
أَيْنَ مَا ثُقِفُوا إِلَّا بِحَبْلٍ مِنَ اللهِ وَحَبْلٍ مِنَ النَّاسِ وَبَاءُوا بِغَضَبٍ مِنَ اللهِ وَضُرِبَتْ عَلَيْهِمُ الْمَسْكَنَةُ
ذَلِكَ بِأَنَّهُمْ كَانُوا يَكْفُرُونَ بِآيَاتِ اللهِ وَيَقْتُلُونَ الْأَنْبِيَاءَ بِغَيْرِ حَقٍّ ذَلِكَ بِمَا عَصَوْا وَكَانُوا يَعْتَدُونَ ﴿١١٢﴾
لَيْسُوا سَوَاءً مِنْ أَهْلِ الْكِتَابِ أُمَّةٌ قَائِمَةٌ

---

**111) (لَنْ يَضُرُّوكُمْ إِلَّا أَذًى وَإِنْ يُقَاتِلُوكُمْ يُوَلُّوكُمُ الْأَدْبَارَ ثُمَّ لَا يُنْصَرُونَ) - Bu yəhudilər islama daxil olmasalar da, əlbəttə, dilləri ilə sizə tənə edib sözlə əziyyət etməkdən başqa, siz müsəlmanlara bir zərər yetirə bilməzlər. Ancaq, sizinlə savaşsalar, o vaxt tab gətirməyib arxalarını çevirib savaşdan qaçarlar, ondan sonra onlara kömək edən də tapılmaz.** (Bu xəbərin doğruluğu tarixdən məlumdur, bu ayədən sonra neçə dəfə yəhudilərin müsəlmanlarla savaşı olsa da, hamısında məğlub olublar. Bu, uca peyğəmbərimizin haqq olduğuna aşkar bir dəlil və möcüzədir).

**112) (ضُرِبَتْ عَلَيْهِمُ الذِّلَّةُ أَيْنَ مَا ثُقِفُوا) – yəhudilər harda olursa-olsunlar dünyada zillət və həqirlik onlara şamil olub əhatə etdi.** (Bu ayənin məzmunu Bəqərə surəsinin 6-cı ayəsində keçdi. Yenidən burada qeyd olunması təkiddən ötrüdür. Yəni əlbəttə bu mətləb vaqe olacaqdır. Hz. Peyğəmbərimizin doğruluğuna bundan böyük möcüzə nə ola bilər? Bu xəbərdən 1320 il keçib, dünyanın hər bir yerində və hər bir dövlətində yaşayan yəhudilər tamamən zəlildirlər. İnsaf üzrə baxanda bu mətləbə agah olan şəxslərin islamdan başqa dində qalmaları son dərəcə insafsızlıqdır). **(إِلَّا بِحَبْلٍ مِنَ اللهِ وَحَبْلٍ مِنَ النَّاسِ) - həmişə yəhudilər zəlil olarlar, ancaq Allah-Təalanın və müsəlmanların əhdinə daxil olub cizyə verməyi qəbul etsələr, o vaxt zillətdən çıxıb əmin-amanlıqda olacaqlar. (وَبَاءُوا بِغَضَبٍ مِنَ اللهِ) - amma bununla belə yəhudilər Allah-Təaladan gələn əzaba layiq oldular. (وَضُرِبَتْ عَلَيْهِمُ الْمَسْكَنَةُ) - insanların nəzərində zəlil və həqir olmaq onlara şamil oldu. (ذَلِكَ) - bu həqir və zəlil olmaq, (بِأَنَّهُمْ كَانُوا يَكْفُرُونَ بِآيَاتِ اللهِ) - o səbəbə görədir ki, yəhudilər Allah-Təalanın ayələrini və möcüzələrini inkar etdilər. (وَيَقْتُلُونَ الْأَنْبِيَاءَ بِغَيْرِ حَقٍّ) - nahaq və boş yerə peyğəmbərləri qətlə yetirirdilər. (ذَلِكَ) - yenə yəhudilərin bu zəlil olması, (بِمَا عَصَوْا وَكَانُوا يَعْتَدُونَ) - o səbəbə görədir ki, Allah-Təalaya asi olub həmişə Onun qoyduğu həddi aşırlar.** (Doğrudur, bu ayə yəhudilər barəsindədir, amma millət qanunlardan kənar olsa, o millət zəlil və məhv olacaqdır. Biz müsəlmanların bu dövrdəki əhvalı yəhudi millətinin əhvalına yaxındır. Bunun da səbəbi islam qanunlarını tərk edib, özgə qanunlara göz dikmək deyilmi? Gərək, Qurana baxaq, Qurandan alınan qanunlara itaət edək. Quran kimi din və siyasət qanunlarını ehtiva edən başqa hansı kitabdır?)

**113) (لَيْسُوا سَوَاءً) - əhli-kitabın hamısı küfr və inadda bir-biriləri ilə eyni və bərabər deyillər. (مِنْ أَهْلِ الْكِتَابِ أُمَّةٌ قَائِمَةٌ) - əhli-kitabdan gecə vaxtı ibadət**

يَتْلُونَ آيَاتِ اللَّهِ آنَاءَ اللَّيْلِ وَهُمْ يَسْجُدُونَ ﴿١١٣﴾ يُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَيَأْمُرُونَ بِالْمَعْرُوفِ
وَيَنْهَوْنَ عَنِ الْمُنْكَرِ وَيُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَأُولَئِكَ مِنَ الصَّالِحِينَ ﴿١١٤﴾ وَمَا يَفْعَلُوا مِنْ خَيْرٍ
فَلَنْ يُكْفَرُوهُ وَاللَّهُ عَلِيمٌ بِالْمُتَّقِينَ ﴿١١٥﴾ إِنَّ الَّذِينَ كَفَرُوا لَنْ تُغْنِيَ عَنْهُمْ أَمْوَالُهُمْ وَلَا أَوْلَادُهُمْ
مِنَ اللَّهِ شَيْئًا وَأُولَئِكَ أَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ ﴿١١٦﴾ مَثَلُ مَا يُنْفِقُونَ فِي هَذِهِ الْحَيَاةِ الدُّنْيَا
كَمَثَلِ رِيحٍ فِيهَا صِرٌّ أَصَابَتْ حَرْثَ قَوْمٍ ظَلَمُوا أَنْفُسَهُمْ فَأَهْلَكَتْهُ وَمَا ظَلَمَهُمُ اللَّهُ وَلَكِنْ أَنْفُسَهُمْ
يَظْلِمُونَ ﴿١١٧﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَتَّخِذُوا بِطَانَةً مِنْ دُونِكُمْ

---

**edənlər vardır. (يَتْلُونَ آيَاتِ اللَّهِ آنَاءَ اللَّيْلِ) - gecə saatlarında Allah-Təalanın Quranının ayələrini oxuyarlar. (وَهُمْ يَسْجُدُونَ) - özləri də səcdə halında olarlar.** (İbadətlərin ən yüksəyi Allah-Təalaya səcdə etməkdir)**.**

**114) (يُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَيَأْمُرُونَ بِالْمَعْرُوفِ وَيَنْهَوْنَ عَنِ الْمُنْكَرِ وَيُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَأُولَئِكَ مِنَ الصَّالِحِينَ) - əhli-kitabdan iman gətirənlər o şəxslərdir ki, axirət gününə iman gətirib xeyiri əmr, şəri qadağan edib xeyir əməllərə cəhd edirlər. Onlar saleh şəxslərdəndirlər.**

**115) (وَمَا يَفْعَلُوا مِنْ خَيْرٍ فَلَنْ يُكْفَرُوهُ وَاللَّهُ عَلِيمٌ بِالْمُتَّقِينَ) - yəhudilərin iman gətirənləri xeyir əməl etsələr, o əməl onlardan silinməyib, əlbəttə, o əməlin mükafatı onlara yetişəcəkdir. Allah-Təala müttəqi şəxslərin əhvalından agahdır, onlara əməllərindən artıq mükafat verəcəkdir.**

**116) (إِنَّ الَّذِينَ كَفَرُوا لَنْ تُغْنِيَ عَنْهُمْ أَمْوَالُهُمْ وَلَا أَوْلَادُهُمْ مِنَ اللَّهِ شَيْئًا وَأُولَئِكَ أَصْحَابُ النَّارِ هُمْ فِيهَا خَالِدُونَ) - həqiqətən, Allah-Təalanı inkar edən şəxslərin nə malları, nə də övladları heç bir şeydə onları Allah-Təaladan ehtiyacsız etməz və cəhənnəm əhli olub həmişəlik cəhənnəmdə qalarlar.**

**117) (مَثَلُ مَا يُنْفِقُونَ فِي هَذِهِ الْحَيَاةِ الدُّنْيَا) - o şəxslər ki mallarını bu dünyada fəxr etmək, ya da xalqın onları tərif etməsi üçün sərf edirlər, (كَمَثَلِ رِيحٍ فِيهَا صِرٌّ) - onların məsəli soyuq olan bir külək kimidir ki, (أَصَابَتْ حَرْثَ قَوْمٍ ظَلَمُوا أَنْفُسَهُمْ) - o şiddətli soyuğu olan külək Allah-Təalaya asi olduqları üçün özlərinə zülm edən bir qövmün əkin-biçininə yetişəndə, (فَأَهْلَكَتْهُ) - o əkin-biçini məhv edib qurudar, (necə ki bu əkindən mənfəət əldə etmək olmaz, habelə o mal ki Allah-Təaladan ötrü xərclənməyib, o maldan da faydalanmaq olmaz). (وَمَا ظَلَمَهُمُ اللَّهُ) - Allah-Təala onların əkin-biçinini məhv etməklə onlara zülm etməz. (وَلَكِنْ أَنْفُسَهُمْ يَظْلِمُونَ) - əksinə, onlar Allah-Təalaya asi olduqları üçün özlərinə zülm edirlər.**

**118) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) - ey iman gətirən şəxslər, (لَا تَتَّخِذُوا بِطَانَةً مِنْ دُونِكُمْ) - öz dininizdən kənar olan şəxsləri özünüzdən ötrü dost və sirdaş etməyin.** (Hz. Peyğəmbərin zamanında müsəlmanlar bəzi yəhudilərlə dostluq edib,

لَا يَأْلُونَكُمْ خَبَالًا وَدُّوا مَا عَنِتُّمْ قَدْ بَدَتِ الْبَغْضَاءُ مِنْ أَفْوَاهِهِمْ وَمَا تُخْفِي صُدُورُهُمْ أَكْبَرُ قَدْ بَيَّنَّا لَكُمُ الْآيَاتِ إِنْ كُنْتُمْ تَعْقِلُونَ ﴿١١٨﴾ هَا أَنْتُمْ أُولَاءِ تُحِبُّونَهُمْ وَلَا يُحِبُّونَكُمْ وَتُؤْمِنُونَ بِالْكِتَابِ كُلِّهِ وَإِذَا لَقُوكُمْ قَالُوا آمَنَّا وَإِذَا خَلَوْا عَضُّوا عَلَيْكُمُ الْأَنَامِلَ مِنَ الْغَيْظِ قُلْ مُوتُوا بِغَيْظِكُمْ إِنَّ اللَّهَ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿١١٩﴾ إِنْ تَمْسَسْكُمْ حَسَنَةٌ تَسُؤْهُمْ وَإِنْ تُصِبْكُمْ سَيِّئَةٌ يَفْرَحُوا بِهَا وَإِنْ تَصْبِرُوا وَتَتَّقُوا لَا يَضُرُّكُمْ كَيْدُهُمْ شَيْئًا

---

sirlərini onlara izhar edərdilər. Yəhudilər də onların sirlərini aşkar edib onlarla düşmənçilik edərdilər, bu ayədə Allah-Təala müsəlmanlara yəhudilərlə dostluq edib onlara sirlərini izhar etməyi qadağan edir. Yəhudilər xəyanətkar bir qövmdürlər). (لَا يَأْلُونَكُمْ خَبَالًا) **- yəhudilər fəsad törətmək fikrindədirlər.** (وَدُّوا مَا عَنِتُّمْ) **- sizin zərər və məşəqqətə düşməyinizi istəyirlər.** (قَدْ بَدَتِ الْبَغْضَاءُ مِنْ أَفْوَاهِهِمْ) **- siz müsəlmanlar yəhudilərin kin və ədavətini bilmirsiniz, amma həqiqətən, nifrət və ədavətləri onların ağızlarından çıxan sözlərdən zahir və aşkardır. Amma siz fikir vermirsiniz.** (وَمَا تُخْفِي صُدُورُهُمْ أَكْبَرُ) **- qəlblərində sizdən məxfi saxlayıb gizlətdikləri ədavət isə daha böyükdür.** (قَدْ بَيَّنَّا لَكُمُ الْآيَاتِ) **- həqiqətən, sizdən ötrü o ayələri bəyan edirik ki, onlar öz dininizi sevib, ixlaslı olub Allah-Təalanın düşmənləri ilə dostluq etməməyiniz üçün bir dəlildir.** (إِنْ كُنْتُمْ تَعْقِلُونَ) **- əgər söz anlayıb əməl edənsinizsə, əlbəttə, gərək bu sözlərə əməl edəsiniz.**

**119)** (هَا أَنْتُمْ أُولَاءِ) **- siz müsəlmanlar bu münafiq yəhudilərlə dostluq etməklə xəta edibsiniz.** (تُحِبُّونَهُمْ وَلَا يُحِبُّونَكُمْ) **- siz yəhudiləri sevirsiniz, amma onlar sizi sevmirlər, belə olan halda siz nəyə görə onları sevirsiniz?** (وَتُؤْمِنُونَ بِالْكِتَابِ كُلِّهِ) **- siz Tövratın bütün ehkamına iman gətiribsiniz. Amma onlar sizin kitaba əsla iman gətirməyiblər.** (وَإِذَا لَقُوكُمْ قَالُوا آمَنَّا) **- yəhudilər sizinlə qarşılaşdıqlarında deyirlər ki, biz də sizin kimi kitabınıza iman gətirdik.** (وَإِذَا خَلَوْا عَضُّوا عَلَيْكُمُ الْأَنَامِلَ مِنَ الْغَيْظِ) **– bir-biriləri ilə təkbətək qaldıqlarında isə sizə olan qəzəblərindən barmaqlarını dişləyərlər.** (قُلْ مُوتُوا بِغَيْظِكُمْ) - (ey Məhəmməd), **yəhudilərə de ki, bu kininizin içində ölün, Allah-Təala islama rövnəq verib, sizi zəif edib həmin qəzəblə də həlak olacaqsınız.** (إِنَّ اللَّهَ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ) **- həqiqətən, münafiqlərin sinələrində olan sirlərdən Allah-Təala agahdır.**

**120)** (إِنْ تَمْسَسْكُمْ حَسَنَةٌ تَسُؤْهُمْ) **- ey möminlər, əgər * dünyada sizə xeyir və mənfəət yetişsə, o xeyir və mənfəətin sizə yetişməsi yəhudiləri münafiqləri qəmgin və məhzun edər.** (وَإِنْ تُصِبْكُمْ سَيِّئَةٌ) **- əgər dünyada sizə bir zərər yetişsə,** (يَفْرَحُوا بِهَا) **- o zərərin yetişməsinə şad olarlar.** (وَإِنْ تَصْبِرُوا وَتَتَّقُوا) **- əgər siz möminlər yəhudilərin və münafiqlərin əziyyətinə səbir edib, Allah-Təalanın haram etdiyi şeylərdən çəkinsəniz,** (لَا يَضُرُّكُمْ كَيْدُهُمْ شَيْئًا) **- onla-**

إِنَّ اللَّهَ بِمَا يَعْمَلُونَ مُحِيطٌ ﴿١٢٠﴾ وَإِذْ غَدَوْتَ مِنْ أَهْلِكَ تُبَوِّئُ الْمُؤْمِنِينَ مَقَاعِدَ لِلْقِتَالِ وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ ﴿١٢١﴾

---

**rın məkr və hiyləsi sizə zərər verməz. (إِنَّ اللَّهَ بِمَا يَعْمَلُونَ مُحِيطٌ) - həqiqətən, yəhudilərin etdiyi hər bir şey Allah-Təalanın elmi daxilində olub, onlardan agahdır.**

*(*Qeyd: Allah-Təala bu ayədə düşmənə qalib olmağın yolunu son dərəcə incəlik və diqqətlə bəyan edir. Ayədən hasil olan budur. Hansı millət başqalarına, düşməninə qalib və hakim olmaq istəsə, gərək, öz şan və şövkətini, fəzilət və cəlalını zamanın adətinə görə inkişaf etdirib artırsın. Elə ki o millətin şanı və qüvvəti artdı, özgə millətlər istər-istəməz ona tabe olub onun qarşısında zəlil və məhv olacaqlar. Bu mətləb Allah-Təalanın bu sözündən məlum olur ki, buyurur: "Əgər sizə dünyada bir xeyir və mənfəət yetişsə, düşmənləriniz ondan qəmgin olarlar". Buna görə də düşməni qəmgin və zəlil edən şeyi əldə etmək lazımdır, həmişə düşmənin nəzərində böyük olub onu qəmgin və zəlil edən şeyləri əldə etmək üçün çalışmaq lazımdır. Lakin heyif olsun ki, müsəlmanlar Qurani-Şərifin siyasi ehkamlarından qafil olduqları üçün az qalıblar ki, yəhudilər kimi başqa millətlərin arasında zəlil və həqir olsunlar).*

**121 (وَإِذْ غَدَوْتَ مِنْ أَهْلِكَ تُبَوِّئُ الْمُؤْمِنِينَ مَقَاعِدَ لِلْقِتَالِ وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ) -** (bu ayə və bundan sonra gələn bir neçə ayə Uhud savaşına işarədir. Buyurur: "Ey Məhəmməd, yadına sal), **o zaman ki Uhud* yerində möminlər üçün savaş mövqeləri təyin etmək üçün səhər vaxtı öz ailənin yanından çıxmışdın, Allah-Təala möminlərin danışdığı sözləri eşidib, onların niyyətlərindən agahdır ki, görəsən, cihad niyyəti ilə çıxıblar, yoxsa yox.** (Uhud savaşının qissəsi müxtəsər şəkildə belədir ki, qeyd olunur).

*(*Qeyd: Uhud bir dağın adıdır, bir mil Mədinədən kənardadır. Orada hicri 3-cü ildə Hz. Peyğəmbərin Məkkə əhliylə savaşı olubdur).*

**Hicrətin 3-cü ilində, şəvval ayının 12-ci günündə, çərşənbə günü Məkkə əhlindən 3000 nəfər toplanıb Mədinəyə Hz. Peyğəmbərlə savaşa gəldilər. Uhud dağının ətrafında yerləşdilər. Hz. Peyğəmbər bu mətləbdən xəbərdar olub, səhabələrini toplayıb onlarla məşvərət etdi ki, bəs Mədinədən çıxıb Uhudda savaşaq, yoxsa şəhərin içində qalaq. Əgər onlar şəhərə gəlsələr, bizimlə şəhərdə savaşa bilməzlər, biz onlara qalib olarıq. Bu barədə məşvərət edib səhabələrindən rəy istədi. Hz. Peyğəmbər bu dəfə münafiq Abdullah ibn Übeyi də şuraya dəvət etmişdi. Bundan başqa, heç bir şuraya onu dəvət etməmişdi. Abdullah ibn Übey və ənsardan bir qrup dedi: "Ey Peyğəmbər, məsləhət odur ki, Mədinədən çıxmayın, bundan qabaq nə vaxt ki düşmən bizə hücum edib, şəhərdə qaldığımız zamanlar düşmənə qalib olmuşuq, amma şəhərdən çıxdığımız vaxtlarda düşmən bizə qalib gəlibdir. Çünki şəhərin küçələrində onlar bizimlə sava-**

**şa bilməzlər, bir tərəfdən biz savaşarıq, o bir tərəfdən də qadınlar, uşaqlar damların üstündən daşla onları qovarlar". Hz. Peyğəmbər bu rəyi bəyənib xoşladı. Amma ənsardan bir qrup da belə dedi: "Ey Peyğəmbər, necə ola bilər ki, biz qadınlar kimi evlərdə gizlənək, düşmənlər də desin ki, bizdən qorxdular, gərək biz onların qabağına çıxıb onlarla savaşaq". Bu kimi müxtəlif fikirlər irəli sürüldü. Axırda əksəriyyətin rəyi ilə Mədinədən kənara çıxmağa qərar verildi. Amma Hz. Peyğəmbərin rəyi Mədinədə qalmaq idi.** (İndiki dövrdə bütün müdrik insanlar tərəfindən bəyənilən şura məclisinin ilk qurucusu bizim peyğəmbərimizdir. Bu, müsəlmanlar üçün bir iftixar səbəbidir). **O zaman da Hz. Peyğəmbər öz mənzilinə daxil olub möminlərin anası Aişənin mənzilində zirehini geyinib çıxdı. Elə ki səhabələr Hz. Peyğəmbərin zirehini geyindiyini gördülər, peşman oldular. Çünki Hz. Peyğəmbərin rəyi Mədinədə qalmaq idi, onlar isə onun rəyinin əksini seçmişdilər. Dedilər: "Ey Peyğəmbər, necə ki öz rəyindir, elə də hərəkət et, Mədinədə qalaq, fərman ver, itaət edək". Hz. Peyğəmbər buyurdu: "Artıq vaxt keçib, peyğəmbərə layiq olmaz ki, zirehini geyəndən sonra yenidən çıxartsın". Ondan sonra hökm verdi ki, cümə günü əsr namazından sonra gecə vaxtı ordu köç edib Uhud dağının ətəyində yerləşsin. Şəvval ayının 15-i, şənbə günü düşmənin qarşısında yerləşdilər. Abdullah ibn Cübeyrə 50 nəfər oxatan ilə Uhud dağının keçidində yerləşməyi əmr etdi. Onlara buyurdu ki, hərçənd düşmənə qalib olduğumuzu görsəniz də, buradan hərəkət etməyin ki, düşmən bizim arxamızdan gəlməsin. İslam ordusu 1000 nəfərdən ibarət idi. Elə ki düşmənlə üzbəüz oldular, münafiq Abdullah ibn Übey 300 nəfərlə Hz. Peyğəmbərdən ayrılıb Mədinəyə qayıtdı. İslam ordusu 700 nəfər qaldı. Savaş başladı. Allah-Təala onlara qüvvət verdi 3 min nəfərlik müşrik ordusunu məğlub etdilər. Müşriklər qaçmağa başladılar. Müsəlmanlar onların mallarını qənimət götürdülər. Uhud dağının keçidində olan 50 oxatan elə ki müşriklərin dağılıb müsəlmanların qənimət topladığını gördülər, onlar da qənimət almaq üçün oradan ayrılıb mövqelərini tərk etdilər. Onların rəisi Abdullah ibn Cübeyr onlara getməyi qadağan etsə də, ona itaət etməyib getdilər. Abdullah ibn Cübeyr 12 nəfərlə qaldı. O biri tərəfdən müşriklər baxıb gördülər ki, dağ keçidi müsəlman əsgərlərindən boşaldı. Xalid* ibn Vəlid bir dəstə əsgərlə arxa tərəfdən gəlib qəflətən o 12 nəfərin üstünə hücum etdi, bir müddət vuruşdular. 12 nəfər müsəlmanın hamısı şəhid oldu. Ondan sonra Xalid ibn Vəlid arxa tərəfdən savaş meydanına yönəldi. O biri tərəfdən müşriklər bu mətləbdən xəbərdar olub geri qayıtdılar. Hz. Peyğəmbərin ordusunu mühasirəyə salıb məğlub etdilər. Hz. Peyğəmbəri başından yaraladılar, dişini sındırdılar. Bütün müsəlmanlar dağıldı, onlardan ancaq 14 nəfər, xüsusilə, Əli ibn Əbu Talib, Əbu Dücanə Ənsari, Sə`d ibn Əbu Vəqqas və Təlhə ibn Übeydullah və Zübeyr ibnül-**

إِذْ هَمَّتْ طَائِفَتَانِ مِنْكُمْ أَنْ تَفْشَلَا وَاللَّهُ وَلِيُّهُمَا وَعَلَى اللَّهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ ﴿١٢٢﴾ وَلَقَدْ نَصَرَكُمُ اللَّهُ بِبَدْرٍ وَأَنْتُمْ أَذِلَّةٌ فَاتَّقُوا اللَّهَ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿١٢٣﴾ إِذْ تَقُولُ لِلْمُؤْمِنِينَ أَلَنْ يَكْفِيَكُمْ أَنْ يُمِدَّكُمْ رَبُّكُمْ بِثَلَاثَةِ آلَافٍ مِنَ الْمَلَائِكَةِ مُنْزَلِينَ ﴿١٢٤﴾ بَلَى إِنْ تَصْبِرُوا وَتَتَّقُوا وَيَأْتُوكُمْ مِنْ فَوْرِهِمْ هَذَا يُمْدِدْكُمْ رَبُّكُمْ بِخَمْسَةِ آلَافٍ مِنَ الْمَلَائِكَةِ مُسَوِّمِينَ ﴿١٢٥﴾

---

**Əvvam son dərəcə şücaət göstərdilər. O zaman ki münafiq Abdullah ibn Übey 300 nəfərlə Hz. Peyğəmbərdən ayrıldı, islam ordusunun sağ və sol cinahlarında olan ənsardan iki tayfa - Xəzrəcdən bəni-Sələmə və Evsdən bəni-Harisə camaatı da qorxuya düşüb istədilər ki, savaşdan qaçsınlar, yenə də özlərində güc tapıb, Allah-Təalanın köməyi ilə möhkəm dayandılar. Necə ki sıradakı ayədə buyurur).**

*(*Qeyd: Xalid ibn Vəlid Məkkənin fəthi ili olan hicrətin 8-ci ilində Əmr ibnül-Asla birlikdə islamla şərəfləndi. Ondan sonra islamda böyük fəthlər edib, mücahidlər arasında ilk şəxslərdən hesab olunur).*

**122) (إِذْ هَمَّتْ طَائِفَتَانِ مِنْكُمْ أَنْ تَفْشَلَا وَاللَّهُ وَلِيُّهُمَا وَعَلَى اللَّهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ) - yadınıza salın, o zaman ki siz ənsar camaatından iki tayfanın qəlbinə qorxu düşüb istədi ki, Hz. Peyğəmbərdən ayrılsınlar, amma Allah-Təala onların yardımçısı idi, onların qəlbinə qüvvət verdi, möhkəm oldular. Möminlər öz əmrlərində, gərək, Allah-Təalaya təvəkkül etsinlər.**

**123) (وَلَقَدْ نَصَرَكُمُ اللَّهُ بِبَدْرٍ وَأَنْتُمْ أَذِلَّةٌ فَاتَّقُوا اللَّهَ لَعَلَّكُمْ تَشْكُرُونَ) - (siz ənsar camaatı bu Uhud davasında Hz. Peyğəmbərin itaətindən çıxdığınız üçün Allah-Təala sizə kömək olmayıb dağılıb məğlub oldunuz). Amma həqiqətən, Allah-Təala sizə Bədir* savaşında kömək etdi, elə bir halda ki, siz zəif, düşməniniz qüvvətli idi. Bəs Allah-Təaladan qorxub onun peyğəmbərinin itaətindən çıxmayın. Əlbəttə, Allah-Təalanın nemətlərinə gərək şükür edəsiniz.** (Bədir savaşının əhvalatı, inşallah, Ənfal surəsində qeyd olunacaq).

*(*Qeyd: Bədir bir yerin adıdır, Məkkə ilə Mədinə arasında, Məkkəyə yaxındır. İslamda ilk savaş orada baş veribdir).*

**124) (إِذْ تَقُولُ لِلْمُؤْمِنِينَ أَلَنْ يَكْفِيَكُمْ أَنْ يُمِدَّكُمْ رَبُّكُمْ بِثَلَاثَةِ آلَافٍ مِنَ الْمَلَائِكَةِ مُنْزَلِينَ)** – (ey Məhəmməd)**, o zaman ki Bədir savaşında sən möminlərə deyirdin: “Sizə kifayət etməz ki, Allah-Təalanın qatından endirilən 3000 nəfər mələk ilə rəbbiniz sizə kömək etsin?”**

**125) (بَلَى إِنْ تَصْبِرُوا وَتَتَّقُوا وَيَأْتُوكُمْ مِنْ فَوْرِهِمْ هَذَا) - əlbəttə, sizə 3 min nəfər mələyin köməyi kifayət edər, amma əgər müşriklər dərhal gecikmədən sizinlə savaşmağa gəlsələr və siz o zaman səbirli olsanız, (يُمْدِدْكُمْ رَبُّكُمْ بِخَمْسَةِ آلَافٍ مِنَ الْمَلَائِكَةِ) - rəbbiniz o vaxt sizə 5 min nəfər mələk ilə kömək edər, (مُسَوِّمِينَ) - bir halda ki mələklər özlərinə savaşdan ötrü nişan qoymuş ol-**

وَمَا جَعَلَهُ اللَّهُ إِلَّا بُشْرَى لَكُمْ وَلِتَطْمَئِنَّ قُلُوبُكُمْ بِهِ وَمَا النَّصْرُ إِلَّا مِنْ عِنْدِ اللَّهِ الْعَزِيزِ الْحَكِيمِ
﴿١٢٦﴾ لِيَقْطَعَ طَرَفًا مِنَ الَّذِينَ كَفَرُوا أَوْ يَكْبِتَهُمْ فَيَنْقَلِبُوا خَائِبِينَ ﴿١٢٧﴾ لَيْسَ لَكَ مِنَ الْأَمْرِ
شَيْءٌ أَوْ يَتُوبَ عَلَيْهِمْ أَوْ يُعَذِّبَهُمْ فَإِنَّهُمْ ظَالِمُونَ ﴿١٢٨﴾ وَلِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ
يَغْفِرُ لِمَنْ يَشَاءُ وَيُعَذِّبُ مَنْ يَشَاءُ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿١٢٩﴾

---

**sunlar,** (Necə ki ərəblərdə adət idi ki, şücaətli şəxs savaş vaxtı başına qırmızı və ya sarı bir şeyi nişan qoyardı, ya da qarğa qanadından başına əlamət qoyardı, məlum olsun ki, bu kişi savaşmadan geri dönməyəcəkdir. Allah mələklərin kömək etməsini ərəb adət-ənənəsi ilə onlara nişan verir).

**126) (وَمَا جَعَلَهُ اللَّهُ إِلَّا بُشْرَى لَكُمْ وَلِتَطْمَئِنَّ قُلُوبُكُمْ بِهِ وَمَا النَّصْرُ إِلَّا مِنْ عِنْدِ اللَّهِ الْعَزِيزِ الْحَكِيمِ) - Allah-Təala Bədir savaşında ancaq sizə müjdə olub qəlbiniz də rahat olsun deyə, mələklərlə sizə kömək etdi.** (Çünki şəxsin qəlbi rahat olmasa, necə savaşa bilər?) **Həqiqətən, kömək məxluqata qalib olub hər bir əməlin hikmət üzrə ondan meydana gəldiyi Allah-Təala qatındandır. Mələk, ya da başqası Allah-Təalasız kömək edə bilməz.** (Ayədə diqqətlə buna işarə vardır ki, Allah-Təalanın kömək etməsində mələyə, ya da başqasına ehtiyacı yoxdur, lakin insanlar arasında hər bir xeyir əməli mələklərə isnad etmək adət olduğundan Allah-Təala da onların ifadələri ilə danışıb kömək məqamında mələk adını qeyd edir, qəlbləri rahat olub cihad etməkdə möhkəm olsunlar).

**127) (لِيَقْطَعَ طَرَفًا مِنَ الَّذِينَ كَفَرُوا أَوْ يَكْبِتَهُمْ فَيَنْقَلِبُوا خَائِبِينَ) - Allah-Təala müşriklərdən bir tayfanı həlak etmək** (necə ki Bədirdə bəzisi öldürülüb, bəzisi əsir oldu)**, ya da dağılıb savaşdan ümidsiz qaçmaları səbəbi ilə zəlil olmaları üçün sizə kömək oldu.** (Savaşdan qaçan müşriklər son dərəcə zillətlə Məkkəyə dönmüşdülər)**.**

**128) (لَيْسَ لَكَ مِنَ الْأَمْرِ شَيْءٌ أَوْ يَتُوبَ عَلَيْهِمْ أَوْ يُعَذِّبَهُمْ فَإِنَّهُمْ ظَالِمُونَ)** – (ey Məhəmməd),* **mənim bəndələrimin işlərində sənin heç bir ixtiyarın yoxdur. Hərçənd sən müşriklərin tamamən həlak olmasını istəyirsən,**

*(*Qeyd: Ağıl sahibləri bu ayəyə baxsınlar ki, Allah-Təala necə öz bəndələrinin bütün əməllərinin ixtiyarını özünə aid edir. Və bu barədə peyğəmbərini necə məzəmmət edir. Amma bu insafsız məxluqlar heç bir əməllərində Allah-Təalanı yada salmayıb, ehtiyaclarının həllini Allah-Təaladan başqa məxluqlardan istəyirlər. Bu isə Allah-Təalaya şərik qoşmaqdır) bu ixtiyar səndə deyil, əksinə, onların hər bir ixtiyarı Allah-Təaladadır. Sən ancaq müjdələyən və qorxudansan, Allah-Təala onlara ya yardım edər, tövbə edərlər, ya da əgər tövbə etməsələr, onlara əzab edər. Həqiqətən, onlar tövbə etməsələr, zalım olarlar. Zalım şəxslər əzaba layiqdirlər.*

**129) (وَلِلَّهِ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ يَغْفِرُ لِمَنْ يَشَاءُ وَيُعَذِّبُ مَنْ يَشَاءُ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ) - səmalarda və yerdə olan hər şey Allah-Təalanın mülküdür və onun ida-**

**يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا لَا تَأْكُلُوا الرِّبَا أَضْعَافًا مُضَاعَفَةً وَاتَّقُوا اللهَ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿١٣٠﴾ وَاتَّقُوا النَّارَ الَّتِي أُعِدَّتْ لِلْكَافِرِينَ ﴿١٣١﴾ وَأَطِيعُوا اللهَ وَالرَّسُولَ لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿١٣٢﴾ وَسَارِعُوا إِلَى مَغْفِرَةٍ مِنْ رَبِّكُمْ وَجَنَّةٍ عَرْضُهَا السَّمَوَاتُ وَالْأَرْضُ أُعِدَّتْ لِلْمُتَّقِينَ ﴿١٣٣﴾ الَّذِينَ يُنْفِقُونَ فِي السَّرَّاءِ وَالضَّرَّاءِ**

---

**rəsi altındadır. İstədiyi şəxsi** (əgər tövbə etsə) **bağışlayar, istədiyinə də** (əgər tövbə etməsə) **əzab edər. Allah-Təala rəhm edib tövbə edənləri bağışlayandır.**

**130) (يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا لَا تَأْكُلُوا الرِّبَا أَضْعَافًا مُضَاعَفَةً وَاتَّقُوا اللهَ لَعَلَّكُمْ تُفْلِحُونَ) -** (Bəqərə surəsinin 272-ci ayəsində faizin haram olduğunu Allah-Təala bəyan etmişdi. Bu ayədə buyurur ki, necə ki faizin azı haramdır, hətta bir dinar da olsa, eyni şəkildə artıq almaq da eləcə haramdır. Bu mətləbdə məlumdur ki, sələmçi şəxslərin nə qədər imkanı olsa, o qədər çox alacaqlar. Borclu şəxs də naəlac qalıb nə qədər faiz qoyulsa da, onu qəbul edəcəkdir. İslama görə, belə şəxslərin heç bir hörməti yoxdur. Ayənin mənası belədir ki, buyurur:) **ey iman gətirən şəxslər, faizi hədsiz şəkildə artıq alıb yeməyin,**

*(*Qeyd: xəlifə Harun ər-Rəşid əfv edib bağışlamağı sevərdi. Bir dəfə bir şəxsə qəzəblənib onun qətlinə hökm verdi. İbn Übeydə adlı alim bir şəxs orada idi, dedi: "Ey xəlifə, Hz. Peyğəmbər buyurubdur: "Qiyamət günündə Allah-Təala tərəfindən bir carçı car çəkər: hanı o şəxslər ki onların əcr, savabları Allah-Təalanın yanındadır. Gəlib əcrlərini alsınlar". Kim dünyada bağışlayan və əfv edən olsa, o gəlib əcrini alar. Harun ər-Rəşid o şəxsi bağışlayıb onun qətlindən vaz keçdi"). Allah-Təaladan qorxub faiz yeməyi tərk edin. Əlbəttə, siz faiz yeməyi tərk etməklə Allah-Təalanın əzabından nicat taparsınız.*

**131) (وَاتَّقُوا النَّارَ الَّتِي أُعِدَّتْ لِلْكَافِرِينَ)** – (ey faiz yeyənlər), **kafirlərdən ötrü hazırlanan oddan qorxun,** (hər bir sələmçi kafir hökmündədir. Kafirdən ötrü hazırlanan odda ona əzab olunacaqdır).

**132) (وَأَطِيعُوا اللهَ وَالرَّسُولَ لَعَلَّكُمْ تُرْحَمُونَ) - Allah-Təalaya və onun peyğəmbərinə** (Hz. Məhəmmədə) itaət edin, bu itaət səbəbinə ümidiniz olsun ki, əlbəttə, Allah-Təala rəhm edib sizi bağışlayandır. (Amma itaət etmədən Allah-Təalanın bağışlayacağını ümid etmək şeytanın və təkəbbürlü şəxslərin ümid etməsi kimidir).

**133) (وَسَارِعُوا إِلَى مَغْفِرَةٍ مِنْ رَبِّكُمْ وَجَنَّةٍ عَرْضُهَا السَّمَوَاتُ وَالْأَرْضُ أُعِدَّتْ لِلْمُتَّقِينَ) – tələsərək o əməllərə tərəf yönəlin ki, onlar rəbbiniz Allah-Təalanın sizi bağışlamasına səbəb olsun və bir də müttəqi şəxslərdən ötrü hazırlanan, genişliyi səmalar və yer qədər olan cənnətə daxil olmağa səbəb olsun.**

**134) (الَّذِينَ يُنْفِقُونَ فِي السَّرَّاءِ وَالضَّرَّاءِ) - müttəqilərin xüsusiyyətlərindən biri budur ki, varlı olanda da, olmayanda da Allah-Təala yolunda mövcud**

وَالْكَاظِمِينَ الْغَيْظَ وَالْعَافِينَ عَنِ النَّاسِ وَاللَّهُ يُحِبُّ الْمُحْسِنِينَ ﴿١٣٤﴾ وَالَّذِينَ إِذَا فَعَلُوا فَاحِشَةً أَوْ
ظَلَمُوا أَنْفُسَهُمْ ذَكَرُوا اللَّهَ فَاسْتَغْفَرُوا لِذُنُوبِهِمْ وَمَنْ يَغْفِرُ الذُّنُوبَ إِلَّا اللَّهُ وَلَمْ يُصِرُّوا عَلَى مَا فَعَلُوا
وَهُمْ يَعْلَمُونَ ﴿١٣٥﴾ أُولَئِكَ جَزَاؤُهُمْ مَغْفِرَةٌ مِنْ رَبِّهِمْ وَجَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ
فِيهَا وَنِعْمَ أَجْرُ الْعَامِلِينَ ﴿١٣٦﴾ قَدْ خَلَتْ مِنْ قَبْلِكُمْ سُنَنٌ فَسِيرُوا فِي الْأَرْضِ فَانْظُرُوا كَيْفَ كَانَ
عَاقِبَةُ الْمُكَذِّبِينَ ﴿١٣٧﴾ هَذَا بَيَانٌ لِلنَّاسِ وَهُدًى وَمَوْعِظَةٌ لِلْمُتَّقِينَ ﴿١٣٨﴾

---

**olan şeylərdən sədəqə və ehsan verərlər. (وَالْكَاظِمِينَ الْغَيْظَ) – qəzəb vaxtı da səbir edib qəzəblərini saxlayarlar. (وَالْعَافِينَ عَنِ النَّاسِ) - əgər insanlar onlara zülm etmiş olsa, bağışlayıb günahlarından keçərlər. (وَاللَّهُ يُحِبُّ الْمُحْسِنِينَ) - Allah-Təala yaxşı əməl sahibi olan şəxsləri sevər.**

**135) (وَالَّذِينَ إِذَا فَعَلُوا فَاحِشَةً) – nə zaman ki günahkar şəxslər çirkin bir günah** (böyük günah) **etsələr, (أَوْ ظَلَمُوا أَنْفُسَهُمْ)- ya da özlərinə zülm edib hər hansı bir** (kiçik, ya da böyük) **günah etsələr, (ذَكَرُوا اللَّهَ) – günah edəndən sonra Allah-Təalanı zikr edib (فَاسْتَغْفَرُوا لِذُنُوبِهِمْ) - o zikr etməklə əfv edilmək istəyib günahlarından tövbə etsələr, (وَمَنْ يَغْفِرُ الذُّنُوبَ إِلَّا اللَّهُ) - Allah-Təaladan başqa günahları bağışlayan kimdir? (وَلَمْ يُصِرُّوا عَلَى مَا فَعَلُوا) - və tövbə edəndən sonra, gərək, günahlarına geri dönüb onda israr etməsinlər, (وَهُمْ يَعْلَمُونَ) və günahda israr etməyin çirkinliyinə gərək agah olsunlar.** (Gərək, belə tövbə etsinlər).

**136) (أُولَئِكَ) -** (əvvəlki ayədə qeyd olunan) **tövbə edənlərin, (جَزَاؤُهُمْ مَغْفِرَةٌ مِنْ رَبِّهِمْ) - onların mükafatı öz rəbləri Allah-Təala tərəfindən bağışlanmaqdır. (وَجَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ) - bir də o bağlardır ki, onların ağaclarının və qəsrlərinin altından çaylar axar. (خَالِدِينَ فِيهَا) - o cənnətlərdə həmişəlik qalarlar. (وَنِعْمَ أَجْرُ الْعَامِلِينَ) - gözəl əməl edənlərin əcr və savabları nə yaxşıdır?**

**137) (قَدْ خَلَتْ مِنْ قَبْلِكُمْ سُنَنٌ فَسِيرُوا فِي الْأَرْضِ فَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبِينَ) - (həqiqətən, sizdən əvvəl olan ümmətlər haqqında Allah-Təalanın hökmləri ki, onları necə həlak edibdir) yer üzündə səfər edib onların əlamətlərini görün.** (Budur Mədinə ilə Şam arasındakı Ad və Səmud camaatının əlamətləri), **baxın görün, Allah-Təala və onun peyğəmbərini təkzib edənlərin axırı necə oldu?** (Onlara əzab gəlib, hamısı həlak oldu).

**138) (هَذَا بَيَانٌ لِلنَّاسِ وَهُدًى وَمَوْعِظَةٌ لِلْمُتَّقِينَ) - qeyd olunan bu kəlam bütün insanlardan ötrü təkzib edənlərin əhvalını bəyan və izah etmək üçündür. Amma müttəqi şəxslərdən ötrü hidayət və nəsihətdir. Çünki müttəqi şəxslər hidayət taparlar.**

**وَلَا تَهِنُوا وَلَا تَحْزَنُوا وَأَنْتُمُ الْأَعْلَوْنَ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿١٣٩﴾. إِنْ يَمْسَسْكُمْ قَرْحٌ فَقَدْ مَسَّ الْقَوْمَ قَرْحٌ مِثْلُهُ وَتِلْكَ الْأَيَّامُ نُدَاوِلُهَا بَيْنَ النَّاسِ وَلِيَعْلَمَ اللَّهُ الَّذِينَ آمَنُوا وَيَتَّخِذَ مِنْكُمْ شُهَدَاءَ وَاللَّهُ لَا يُحِبُّ الظَّالِمِينَ ﴿١٤٠﴾ وَلِيُمَحِّصَ اللَّهُ الَّذِينَ آمَنُوا وَيَمْحَقَ الْكَافِرِينَ ﴿١٤١﴾ أَمْ حَسِبْتُمْ أَنْ تَدْخُلُوا الْجَنَّةَ وَلَمَّا يَعْلَمِ اللَّهُ الَّذِينَ جَاهَدُوا مِنْكُمْ وَيَعْلَمَ الصَّابِرِينَ ﴿١٤٢﴾**

---

**139) (وَلَا تَهِنُوا وَلَا تَحْزَنُوا وَأَنْتُمُ الْأَعْلَوْنَ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ)-** (bu ayə və bundan sonra gələn ayələrdə Allah-Təala Hz. Peyğəmbərə və möminlərə Uhudda məğlub olduqları üçün təsəlli verir)**, buyurur: "Din yolunda cihad etməkdə zəif və savaşda məğlub olmaqdan qəmgin olmayın, əlbəttə, siz müşriklərə qalib olacaqsınız. Əgər möminsizsə, gərək, cihad etməkdə zəif olmayasınız".**

**140) (إِنْ يَمْسَسْكُمْ قَرْحٌ) - əgər siz bu Uhud davasında yaralandınızsa, (فَقَدْ مَسَّ الْقَوْمَ قَرْحٌ مِثْلُهُ) - həqiqətən, sizinlə savaşan Məkkəli Qüreyş əhli də o cür yaralandı. (وَتِلْكَ الْأَيَّامُ نُدَاوِلُهَا بَيْنَ النَّاسِ) - o gün ki Uhud savaşında düşmən sizə qalib oldu, o elə günlərdir ki, onu insanların arasında növbə ilə dolandırarıq, hər savaşda bir tərəf məğlub olar.** (Necə ki Bədir savaşında siz qalib gəldiniz, amma Uhud savaşında məğlub oldunuz, qalib və məğlub olmaq Allah-Təalanın hökmü ilədir)**. (وَلِيَعْلَمَ اللَّهُ الَّذِينَ آمَنُوا) - Allah-Təala sizi bu savaşda məğlub etdi, möminləri mömin olmayanlardan seçib ayırsın. Görsün ki, kim imanında möhkəmdir və kim deyil. (وَيَتَّخِذَ مِنْكُمْ شُهَدَاءَ)- və yenə məğlub olmaq səbəbinə sizdən bu davada şəhid** (şahid) **olan şəxsləri seçsin. (وَاللَّهُ لَا يُحِبُّ الظَّالِمِينَ) - imanlarında sabit olmayıb, cihadı tərk edib özlərinə zalım olan şəxsləri Allah-Təala sevməz.**

**141) (وَلِيُمَحِّصَ اللَّهُ الَّذِينَ آمَنُوا وَيَمْحَقَ الْكَافِرِينَ) - bir də sizi məğlub etmək ondan ötrüdür ki, Allah-Təala sizi hər bir günahdan pak etsin. Amma kafirləri məğlub etmək ondan ötrüdür ki, onları həlak edib əlamət və izlərini yer üzündən silsin.** (Növbəti ayə Uhud savaşından qaçanların məzəmmət edilməsi haqqındadır)**.**

**142) (أَمْ حَسِبْتُمْ أَنْ تَدْخُلُوا الْجَنَّةَ) - ey savaşdan qaçan şəxslər, bəs belə güman edirsiniz ki, cənnətə daxil olacaqsınız?** (Halbuki cihaddan qaçmaq böyük günahdır)**. (وَلَمَّا يَعْلَمِ اللَّهُ الَّذِينَ جَاهَدُوا مِنْكُمْ) - halbuki Allah-Təala yanında sizdən cihad edənlər məlum olmayıb (وَيَعْلَمَ الصَّابِرِينَ) - və cihad etməkdə səbir edib möhkəm olanlar da bir-birilərindən ayırd edilib məlum olmayıbdır.** (Belə olan halda necə cənnətə daxil olacaqsınız?) (Uhud savaşında Hz. Peyğəmbərin bütün ordusu qaçdı, sadəcə 14 nəfər qaldı, onlar Hz. Peyğəmbəri düşməndən qorudular, necə ki yuxarıda qeyd olundu).

وَلَقَدْ كُنْتُمْ تَمَنَّوْنَ الْمَوْتَ مِنْ قَبْلِ أَنْ تَلْقَوْهُ فَقَدْ رَأَيْتُمُوهُ وَأَنْتُمْ تَنْظُرُونَ ﴿١٤٣﴾ وَمَا مُحَمَّدٌ إِلَّا
رَسُولٌ قَدْ خَلَتْ مِنْ قَبْلِهِ الرُّسُلُ أَفَإِنْ مَاتَ أَوْ قُتِلَ انْقَلَبْتُمْ عَلَى أَعْقَابِكُمْ وَمَنْ يَنْقَلِبْ عَلَى عَقِبَيْهِ فَلَنْ
يَضُرَّ اللَّهَ شَيْئًا وَسَيَجْزِي اللَّهُ الشَّاكِرِينَ ﴿١٤٤﴾ وَمَا كَانَ لِنَفْسٍ أَنْ تَمُوتَ إِلَّا بِإِذْنِ اللَّهِ كِتَابًا مُؤَجَّلًا وَمَنْ
يُرِدْ ثَوَابَ الدُّنْيَا نُؤْتِهِ مِنْهَا

---

**143) (وَلَقَدْ كُنْتُمْ تَمَنَّوْنَ الْمَوْتَ مِنْ قَبْلِ أَنْ تَلْقَوْهُ فَقَدْ رَأَيْتُمُوهُ وَأَنْتُمْ تَنْظُرُونَ) - ey möminlər, peyğəmbəri savaşda necə qoyub qaçdınız, halbuki siz ölümlə qarşılaşmadan əvvəl cihad edib şəhid olmağı arzu edirdiniz. İndi siz savaşda ölümü gördüyünüz bir halda, özü də baxıb görürdünüz ki, din qardaşlarınız savaşıb şəhid olurlar, siz onları qoyub qaçdınız. Bununla, belə yenə cənnəti arzu edirsiniz.** (Uhud savaşında müşriklərdən Abdullah ibn Qamiə bir daş atıb Hz. Peyğəmbərin dişini sındırıb mübarək üzünü yaraladı. Ondan sonra Hz. Peyğəmbəri qətlə yetirmək üçün ona yönəldi. Hz. Peyğəmbərin bayraqdarı olan Müs`əb ibn Ümeyr onun qarşısına çıxdı. Abdullah ibn Qamiə Müs`əbi qətlə yetirdi. Elə zənn etdi ki, peyğəmbəri öldürdü. Ərəblər savaşda üzlərini bağlayardılar, gözlərindən başqa bir yer görünməzdi. Ona görə də Abdullah ibn Qamiə Müs`əbi peyğəmbər saydı. Səsləndi: "Ey insanlar, Məhəmmədi öldürdüm". Bu xəbər yayılıb, Hz. Peyğəmbərin qoşunu dağıldı. Hz. Peyğəmbər səsləndi: "Ey insanlar, mənim tərəfimə gəlin". Onun səsini eşidənlər onun yanında toplandılar. Ənsardan Ənəs ibn Nəzr səsləndi: "Haraya qaçırsınız, əgər Məhəmməd öldüsə, Məhəmmədin Allahı diri və əbədidir. Peyğəmbərdən sonra yaşamağınız nəyə lazımdır?" Ondan sonra dedi: "İlahi, mən bu insanların dediyi sözlərə görə səndən üzr istəyirəm". Müşriklərin ordusuna tərəf hücum edib şəhid oldu. Allah ondan razı olsun. Bu zaman bu ayə nazil oldu).

**144) (وَمَا مُحَمَّدٌ إِلَّا رَسُولٌ قَدْ خَلَتْ مِنْ قَبْلِهِ الرُّسُلُ) - Məhəmməd ancaq Allah-Təala tərəfindən sizə gələn bir peyğəmbərdir. Ondan qabaq çox peyğəmbərlər ölüb gediblər. Bu Məhəmməd də onlardan biridir. (أَفَإِنْ مَاتَ أَوْ قُتِلَ) - əgər bu Məhəmməd öz əcəli ilə ölsə, ya da onu qətlə yetirsələr,** (inqələbtum alə aqabikum) **- siz arxanıza dönüb dindən çıxacaqsınız?** (Din Allah-Təalanın dinidir, Allah-Təala da əzəli və əbədidir). **(انْقَلَبْتُمْ عَلَى أَعْقَابِكُمْ وَمَنْ يَنْقَلِبْ عَلَى عَقِبَيْهِ) – kim arxasına dönüb dindən çıxsa, (فَلَنْ يَضُرَّ اللَّهَ شَيْئًا) - əlbəttə, o şəxs Allah-Təalaya heç bir şey zərər verməz. Onun zərəri özünə aid olar. (وَسَيَجْزِي اللَّهُ الشَّاكِرِينَ) - amma Allah-Təala islamda möhkəm olub islam nemətinə şükür edənlərə, əlbəttə, mükafat verəcəkdir.**

**145) (وَمَا كَانَ لِنَفْسٍ أَنْ تَمُوتَ إِلَّا بِإِذْنِ اللَّهِ كِتَابًا مُؤَجَّلًا) – Allahın izni olmadan kim ölmək istəsə də, öz ixtiyarı ilə ölməz.** (Əgər Allah-Təalanın izni olmasa, heç kim ölməz). **Çünki hər kəsə ölmək üçün müəyyən bir vaxt təyin edilmişdir.** (Niyə cihaddan qaçırsınız?) **(وَمَنْ يُرِدْ ثَوَابَ الدُّنْيَا نُؤْتِهِ مِنْهَا) - kim cihadda**

وَمَنْ يُرِدْ ثَوَابَ الْآَخِرَةِ نُؤْتِهِ مِنْهَا وَسَنَجْزِي الشَّاكِرِينَ ﴿١٤٥﴾ وَكَأَيِّنْ مِنْ نَبِيٍّ قَاتَلَ مَعَهُ رِبِّيُّونَ كَثِيرٌ
فَمَا وَهَنُوا لِمَا أَصَابَهُمْ فِي سَبِيلِ اللَّهِ وَمَا ضَعُفُوا وَمَا اسْتَكَانُوا وَاللَّهُ يُحِبُّ الصَّابِرِينَ ﴿١٤٦﴾ وَمَا كَانَ
قَوْلَهُمْ إِلَّا أَنْ قَالُوا رَبَّنَا اغْفِرْ لَنَا ذُنُوبَنَا وَإِسْرَافَنَا فِي أَمْرِنَا وَثَبِّتْ أَقْدَامَنَا وَانْصُرْنَا عَلَى الْقَوْمِ الْكَافِرِينَ
﴿١٤٧﴾ فَآَتَاهُمُ اللَّهُ ثَوَابَ الدُّنْيَا وَحُسْنَ ثَوَابِ الْآَخِرَةِ وَاللَّهُ يُحِبُّ الْمُحْسِنِينَ ﴿١٤٨﴾ يَا أَيُّهَا الَّذِينَ
آَمَنُوا إِنْ تُطِيعُوا الَّذِينَ كَفَرُوا يَرُدُّوكُمْ عَلَى أَعْقَابِكُمْ فَتَنْقَلِبُوا خَاسِرِينَ ﴿١٤٩﴾

---

**dünya mükafatını istəsə, ona dünyada mükafatını verərik. (O şəxslərə işarədir ki, Uhud davasında qənimət axtarmaqla məşğul idilər). (وَمَنْ يُرِدْ ثَوَابَ الْآَخِرَةِ نُؤْتِهِ مِنْهَا) - və kim cihadda axirət savabını arzu etsə, ona axirət savabını verərik. (وَسَنَجْزِي الشَّاكِرِينَ) - Allah-Təalanın nemətlərinə şükür edib cihadda axirət savabını istəyənlərə, əlbəttə, mükafat verərik.**

**146) (وَكَأَيِّنْ مِنْ نَبِيٍّ قَاتَلَ مَعَهُ رِبِّيُّونَ كَثِيرٌ) - çox peyğəmbərlər olublar ki, o peyğəmbərlərin qabağında çox üləma və dindar şəxslər cihad ediblər. (Cihada ilk gedən siz deyilsiniz ki, mənim peyğəmbərimi** (Məhəmmədi) **qoyub qaçasınız). (فَمَا وَهَنُوا لِمَا أَصَابَهُمْ فِي سَبِيلِ اللَّهِ) - Allah-Təala yolunda cihad etməkdə onlara yetişən bəla və dərddən qorxmayıb süst olmayıblar. (وَمَا ضَعُفُوا وَمَا اسْتَكَانُوا) - zəif olmayıb, özlərini düşmənlərə qarşı zəlil etməyiblər. Ancaq səbir edib düşmənlərin qarşısında möhkəm durublar. Amma siz səbirsizlik edib, peyğəmbərinizi qoyub savaşdan qaçdınız. (وَاللَّهُ يُحِبُّ الصَّابِرِينَ) - Allah-Təala hər bir bəla və müsibətə səbir edənləri sevər.**

**147) (وَمَا كَانَ قَوْلَهُمْ إِلَّا أَنْ قَالُوا رَبَّنَا اغْفِرْ لَنَا ذُنُوبَنَا وَإِسْرَافَنَا فِي أَمْرِنَا وَثَبِّتْ أَقْدَامَنَا وَانْصُرْنَا عَلَى الْقَوْمِ الْكَافِرِينَ) - əvvəlki peyğəmbərlərin qarşısında savaşanların sözləri ancaq bu dua idi: "Ey bizim rəbbimiz, bizim günahlarımızı və işlərimizdə həddimizi aşmağımızı bizə bağışla, bizim qədəmlərimizi cihadda möhkəm et, kömək edib bizi kafirlərə qalib et.**

**148) (فَآَتَاهُمُ اللَّهُ ثَوَابَ الدُّنْيَا وَحُسْنَ ثَوَابِ الْآَخِرَةِ وَاللَّهُ يُحِبُّ الْمُحْسِنِينَ) - onların möhkəm olmalarının əvəzində Allah-Təala onlara dünya əcrlərini** (düşmənə qalib olub qənimət almaq) **və gözəl axirət savabını, hər ikisini onlara bəxş etdi. Allah-Təala yaxşı əməl sahiblərini sevər.**

**149) (يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا إِنْ تُطِيعُوا الَّذِينَ كَفَرُوا يَرُدُّوكُمْ عَلَى أَعْقَابِكُمْ فَتَنْقَلِبُوا خَاسِرِينَ) -** (Uhud savaşında islam qoşunu məğlub olanda münafiqlər müsəlmanlara dedilər: "Gəlin müşriklərə qoşulub əsl din olan bütpərəstliyə qayıdın". Bu mətləbi Allah-Təala bu ayədə bəyan edir. Buyurur: ) **ey iman gətirənlər, əgər kafirlərə itaət etsəniz, onlar sizi islamdan küfr tərəfinə qaytararlar. O zaman həm dünyada, həm də axirətdə ziyan etdiyiniz halda, islamdan çıxmış olarsınız.**

بَلِ اللَّهُ مَوْلَاكُمْ وَهُوَ خَيْرُ النَّاصِرِينَ ﴿١٥٠﴾ سَنُلْقِي فِي قُلُوبِ الَّذِينَ كَفَرُوا الرُّعْبَ بِمَا أَشْرَكُوا بِاللَّهِ مَا لَمْ يُنَزِّلْ بِهِ سُلْطَانًا وَمَأْوَاهُمُ النَّارُ وَبِئْسَ مَثْوَى الظَّالِمِينَ ﴿١٥١﴾ وَلَقَدْ صَدَقَكُمُ اللَّهُ وَعْدَهُ إِذْ تَحُسُّونَهُمْ بِإِذْنِهِ حَتَّى إِذَا فَشِلْتُمْ وَتَنَازَعْتُمْ فِي الْأَمْرِ وَعَصَيْتُمْ

---

**150) (بَلِ اللَّهُ مَوْلَاكُمْ وَهُوَ خَيْرُ النَّاصِرِينَ) - siz müsəlmanlar, gərək, münafiq və kafirlərdən kənar olub onlara olan ehtiyacınızı izhar etməyəsiniz. Onlardan sizə kömək olmaz. Sizin köməyiniz ancaq Allah-Təaladır. Və kömək edənlərin ən yaxşısı odur.** (Elə ki Uhud savaşında Hz. Peyğəmbərin qoşunu məğlub oldu, müşriklər Məkkə tərəfinə qayıtmağa başladılar, bir qədər yol gedəndən sonra peşman oldular. Müşriklərin rəisi Əbu Süfyan və ondan başqa böyük şəxslər dedilər: "Bu nə pis əməldir etdik, Məhəmmədin qoşununu məğlub etdik, onları o halda qoyub yola düşdük. Qayıdın gedək, onları tamamən qətlə yetirib Mədinəni xaraba edək". Elə ki qayıtmağa niyyət etdilər, Allah-Təala onların qəlblərinə qorxu salıb qayıtmalarına mane oldu. Bu biri tərəfdən Mədinə əhli onların qayıtmağını eşidib qorxuya düşdü. Allah-Təala növbəti ayədə müşriklərin qəlbinə qorxu salıb onları qayıtmalarına mane olduğunu Mədinənin müsəlman əhlinə xəbər verir. Ta ki onların qəlbləri sakit olub müşriklərin qayıtmasından qorxmasınlar).

**151) (سَنُلْقِي فِي قُلُوبِ الَّذِينَ كَفَرُوا الرُّعْبَ) - ey möminlər, müşriklərin qayıtmasından qorxmayın, əlbəttə, onların qəlblərinə qorxu saldıq ki, sizin tərəfinizə qayıdıb gəlməsinlər. (بِمَا أَشْرَكُوا بِاللَّهِ) - Allah-Təalaya şərik qoşduqları üçün qəlblərinə qorxu saldıq. (مَا لَمْ يُنَزِّلْ بِهِ سُلْطَانًا) - Allah-Təalaya o şeyi şərik qoşdular ki, onun şərik olması haqqında Allah-Təala heç bir dəlil və sübut nazil etməyibdir. (وَمَأْوَاهُمُ النَّارُ) - onların məkanı cəhənnəm odudur. (وَبِئْسَ مَثْوَى الظَّالِمِينَ) - zalımların məkanı nə pis yerdir.** (Hz. Peyğəmbər Uhud savaşından Mədinəyə qayıdanda müsəlmanlar dedilər: "Bu nə bəla idi, bizə yetişdi, halbuki Allah-Təala bizə kömək edəcəyini vəd etmişdi". O zaman bu ayə nazil oldu).

**152) (وَلَقَدْ صَدَقَكُمُ اللَّهُ وَعْدَهُ) - həqiqətən, Allah-Təala** (Uhud savaşında) **öz vədinə sadiq olub, sizə yardım edib, əvvəlcə düşmənə qalib oldunuz. (إِذْ تَحُسُّونَهُمْ بِإِذْنِهِ) - o zaman ki Allah-Təalanın izni ilə müşrikləri pis bir şəkildə qətlə yetirirdiniz,** (müsəlmanlar əvvəlcə müşriklərə qalib olub onları məğlub etdilər, elə ki dağ keçidində olan 50 oxatan itaətdən çıxıb, qənimət toplamaq üçün savaş meydanına getdi, o zaman asi olduqları üçün Allah-Təala müşrikləri onlara qalib etdi. Necə ki buyurur:) **(حَتَّى إِذَا فَشِلْتُمْ) - siz müsəlmanlar müşriklərə qalib idiniz, o zamana qədər ki, siz** (dağ keçidində duranlar) **rəyinizdə zəif olub ixtilaf etdiniz. (وَتَنَازَعْتُمْ فِي الْأَمْرِ وَعَصَيْتُمْ) – verilən əmrdə** (durub-durmamaqda) **bir-birinizlə ixtilaf və mübahisə et-**

مِنْ بَعْدِ مَا أَرَاكُمْ مَا تُحِبُّونَ مِنْكُمْ مَنْ يُرِيدُ الدُّنْيَا وَمِنْكُمْ مَنْ يُرِيدُ الْآخِرَةَ ثُمَّ صَرَفَكُمْ عَنْهُمْ لِيَبْتَلِيَكُمْ وَلَقَدْ عَفَا عَنْكُمْ وَاللَّهُ ذُو فَضْلٍ عَلَى الْمُؤْمِنِينَ ﴿١٥٢﴾ إِذْ تُصْعِدُونَ وَلَا تَلْوُونَ عَلَى أَحَدٍ وَالرَّسُولُ يَدْعُوكُمْ فِي أُخْرَاكُمْ فَأَثَابَكُمْ غَمًّا بِغَمٍّ لِكَيْلَا تَحْزَنُوا عَلَى مَا فَاتَكُمْ وَلَا مَا أَصَابَكُمْ وَاللَّهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ ﴿١٥٣﴾

---

**diniz, bəziləriniz dediniz: "Müşriklər dağıldılar, bizim burada durmağımız lazım deyil," bəziniz də dediniz: "Peyğəmbərin əmrindən çıxmarıq, gərək, burada duraq". Bu ixtilafdan sonra peyğəmbərin əmrinə asi olub dağ keçidindən ayrıldınız.** (Orada qalıb şəhid olan 12 nəfər və rəisləri olan Abdullah ibn Cübeyirdən başqa, hamısı dağ keçidindən ayrıldılar, necə ki yuxarıda qeyd olundu). **(مِنْ بَعْدِ مَا أَرَاكُمْ مَا تُحِبُّونَ) – O, sizə sevdiyiniz şeyi** (yardım görüb düşmənə qalib olmaq) **göstərəndən sonra asi oldunuz, (halbuki gərək itaət edəydiniz. Amma itaət əvəzinə asi oldunuz). (مِنْكُمْ مَنْ يُرِيدُ الدُّنْيَا) - sizdən bəzi şəxslər** (dağdan ayrılıb qənimətdən ötrü gələnlər) **vardır ki, cihad etməkdə məqsədləri dünyadır. (وَمِنْكُمْ مَنْ يُرِيدُ الْآخِرَةَ) - və sizdən bəzi şəxslər də** (dağ keçidində qalıb şəhid olanlar) **vardır ki, cihad etməkdə məqsədləri axirətdir. (ثُمَّ صَرَفَكُمْ عَنْهُمْ لِيَبْتَلِيَكُمْ) - siz müsəlmanlar müşriklərə qalib olandan sonra peyğəmbərin itaətindən çıxıb asi olduğunuz üçün Allah-Təala müşrikləri sizə qalib etdi. Ta ki sizi imtahan etsin. Görəsən, müsibətə səbir edib imanınızda möhkəm olursunuz, yoxsa yox? (وَلَقَدْ عَفَا عَنْكُمْ) - siz peyğəmbərə asi olandan sonra tövbə etdiyiniz üçün Allah-Təala, həqiqətən, sizi əfv edib, bu asi olmağınızın günahını sizə bağışladı. (وَاللَّهُ ذُو فَضْلٍ عَلَى الْمُؤْمِنِينَ) - Allah-Təala möminlərə lütf və rəhmət sahibidir. Elə ki tövbə etdilər, onların günahını bağışlayar.**

**153) (إِذْ تُصْعِدُونَ) - Allah-Təala sizi o vaxt məğlub etdi ki, peyğəmbərdən qaçıb uzaqlaşıb, (وَلَا تَلْوُونَ عَلَى أَحَدٍ) - şiddətli qorxudan heç kimə baxmırdınız, (وَالرَّسُولُ يَدْعُوكُمْ فِي أُخْرَاكُمْ) – halbuki peyğəmbər arxanızdan sizə səslənib çağırdı. (فَأَثَابَكُمْ غَمًّا بِغَمٍّ) – peyğəmbərin itaətindən çıxıb ona qəm-qüssə verdiyiniz üçün Allah-Təala da sizi məğlub edib sizə böyük qəm-qüssə cəzası verdi. (لِكَيْلَا تَحْزَنُوا عَلَى مَا فَاتَكُمْ وَلَا مَا أَصَابَكُمْ) - sizdən ötrü adət olsun, biləsiniz ki, insan dünyada qəm-qüssədən xali olmaz və daha bundan sonra gələn müsibətə, ya da əlinizdən gedən mənfəətə görə, məhzun və qəmgin olmayasınız deyə Allah-Təala sizi məğlub edib qəm-qüssə verdi.** (Əgər bu xüsusiyyətdə olsaydılar, qəniməti itirməkdən qəmgin olmayıb dağ keçidindən ayrılmayıb məğlub və zəlil olmazdılar). **(وَاللَّهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ) - Allah-Təala etdiyiniz hər şeydən agahdır.** (Hz. Peyğəmbərin qoşunu dağılıb qaçan vaxt Allah-Təala möminləri yuxuya düçar eddi, qaça bilmədilər. Amma münafiqləri yuxu tutmadı. Möminlərin yuxuya getməsində bir neçə

**ثُمَّ أَنْزَلَ عَلَيْكُمْ مِنْ بَعْدِ الْغَمِّ أَمَنَةً نُعَاسًا يَغْشَى طَائِفَةً مِنْكُمْ وَطَائِفَةٌ قَدْ أَهَمَّتْهُمْ أَنْفُسُهُمْ يَظُنُّونَ بِاللَّهِ غَيْرَ الْحَقِّ ظَنَّ الْجَاهِلِيَّةِ يَقُولُونَ هَلْ لَنَا مِنَ الْأَمْرِ مِنْ شَيْءٍ قُلْ إِنَّ الْأَمْرَ كُلَّهُ لِلَّهِ يُخْفُونَ فِي أَنْفُسِهِمْ مَا لَا يُبْدُونَ لَكَ يَقُولُونَ لَوْ كَانَ لَنَا مِنَ الْأَمْرِ شَيْءٌ مَا قُتِلْنَا هَاهُنَا قُلْ لَوْ كُنْتُمْ فِي بُيُوتِكُمْ لَبَرَزَ الَّذِينَ كُتِبَ عَلَيْهِمُ الْقَتْلُ إِلَى مَضَاجِعِهِمْ وَلِيَبْتَلِيَ اللَّهُ مَا فِي صُدُورِكُمْ**

---

fayda var idi, biri bu idi ki, qaça bilmədilər, ikincisi, bir-biriləri ilə danışmaq və bir-birilərini qorxutmaq mümkün olmadı. Üçüncüsü, bildilər ki, hər bir şey Allah-Təalanın qüdrətinə tabedir. Hətta qaçmaq da onlara mümkün olmadı. Dördüncüsü, qorxunu onlardan götürdü. Bir növ əmin-amanlıqda oldular. Çünki qorxusu olan şəxs yata bilməz. Amma münafiqlər yata bilmədi. Qaçıb Mədinəyə getdilər. Onların nifaqı zahir oldu. Necə ki sıradakı ayədə buyurur:)

**154) (ثُمَّ أَنْزَلَ عَلَيْكُمْ مِنْ بَعْدِ الْغَمِّ أَمَنَةً نُعَاسًا) - qaçıb dağılıb sizi qəm-qüssə tutandan sonra Allah-Təala sizə yuxu göndərdi. Ta ki sizi yuxu tutub əmin-amanlıqda olub xatircəm olasınız. (يَغْشَى طَائِفَةً مِنْكُمْ) – sizdən savaşda olan bir tayfanı** (möminləri) **yuxu tutdu. (وَطَائِفَةٌ) - amma digər tayfanı** (münafiqləri) **yuxu tutmayıb, (قَدْ أَهَمَّتْهُمْ أَنْفُسُهُمْ) – qorxu içində qalıb, fikirləri özlərində oldu ki, bəlkə özlərini xilas etsinlər.** (Onlarda din və peyğəmbər fikri olmayıb)**. (يَظُنُّونَ بِاللَّهِ غَيْرَ الْحَقِّ) - Allah-Təalaya qarşı haqsız zənn, güman bəsləyirdilər.** (Güman edirdilər ki, Allah-Təala müsəlmanlara kömək etməyib islam dini məhv olacaq). **(ظَنَّ الْجَاهِلِيَّةِ) - bu zənn, güman etmək cahiliyyə zamanının gümanı kimidir.** (Amma bu zaman – Hz. Məhəmmədin zamanı elm* zamanıdır. Gərək o cənabın çırağından nur əldə edib, Allah-Təaladan yaxşı agah olasınız). **(يَقُولُونَ هَلْ لَنَا مِنَ الْأَمْرِ مِنْ شَيْءٍ) - münafiqlər peyğəmbərdən soruşub deyirdilər: "Bəs düşmənə qarşı bizə yardım olub, qalib olacağıq, yoxsa yox?" (قُلْ إِنَّ الْأَمْرَ كُلَّهُ لِلَّهِ) -** (ey Məhəmməd)**, o münafiqlərə de ki, həqiqətən, yardım və qələbə, qəza və qədər Allah-Təalanın qüdrətindədir. Necə istəsə, elə də edər. (يُخْفُونَ فِي أَنْفُسِهِمْ مَا لَا يُبْدُونَ لَكَ) -** (ey Məhəmməd)**, o münafiqlər sənə izhar etmədikləri şeyi öz içlərində gizlədirlər. (يَقُولُونَ لَوْ كَانَ لَنَا مِنَ الْأَمْرِ شَيْءٌ) -** (münafiqlərin gizlətdiyi sözlər budur)**, öz aralarında səndən gizlin deyirlər: "Əgər Allah-Təala bizə kömək və qələbə versəydi, (مَا قُتِلْنَا هَاهُنَا) - hər halda, biz də bu Uhud savaşında öldürülməzdik". (قُلْ لَوْ كُنْتُمْ فِي بُيُوتِكُمْ) -** (ey Məhəmməd)**, onlara de ki, əgər evlərinizdə otursanız da, (لَبَرَزَ الَّذِينَ كُتِبَ عَلَيْهِمُ الْقَتْلُ إِلَى مَضَاجِعِهِمْ) - öldürülməsi təyin olunan şəxslər qətl olunacaqları yerlərinə gedib onlardan ötrü təyin olunan zaman və məkanda öldürüləcəklər.** (Evdə oturmaq insanı ölümdən qorumaz)**. (وَلِيَبْتَلِيَ اللَّهُ مَا فِي صُدُورِكُمْ) - Allah-Təala sizi cihad və qətl tərəfinə çıxarır, sizin sinənizdə olan sirləri imtahan etsin. Görsün, sizdən (iman, yoxsa nifaq) hansı biri zahir olur,**

**وَلِيُمَحِّصَ مَا فِي قُلُوبِكُمْ وَاللَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿١٥٤﴾ إِنَّ الَّذِينَ تَوَلَّوْا مِنْكُمْ يَوْمَ الْتَقَى الْجَمْعَانِ**
**إِنَّمَا اسْتَزَلَّهُمُ الشَّيْطَانُ بِبَعْضِ مَا كَسَبُوا وَلَقَدْ عَفَا اللَّهُ عَنْهُمْ إِنَّ اللَّهَ غَفُورٌ حَلِيمٌ ﴿١٥٥﴾ يَا أَيُّهَا الَّذِينَ**
**آمَنُوا لَا تَكُونُوا كَالَّذِينَ كَفَرُوا وَقَالُوا لِإِخْوَانِهِمْ إِذَا ضَرَبُوا فِي الْأَرْضِ أَوْ كَانُوا غُزًّى**

---

(***Qeyd:** *Nə böyük mərtəbədir elmin mərtəbəsi, Qurani-Şərifdə hər bir məqamda cəhalət məzəmmət edilir və elm tərif edilir, amma müsəlmanlar Qurani-Şərifin İsa kimi ölü dirildən ayələrinin mübarək mənalarından necə qafil olub, özlərini cəhalətə salıblar. Gərək elm cənnətini qazanıb, cəhalətin yandırıcı odundan çəkinib kənar olsunlar).*

**(وَلِيُمَحِّصَ مَا فِي قُلُوبِكُمْ) - və siz möminlərin qəlblərini şeytanın vəsvəsəsindən pak və təmiz etsin.** (Amma münafiqlər şəkk içində qalıb heç vaxt onlara iman ruzisi qismət olmaz). **(وَاللَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ) - Allah-Təala sinələrdə olan sirlərdən agahdır.**

**155) (إِنَّ الَّذِينَ تَوَلَّوْا مِنْكُمْ يَوْمَ الْتَقَى الْجَمْعَانِ) - həqiqətən, siz müsəlmanlardan o şəxslər ki iki camaat** (müşriklər və müsəlmanlar) **üzbəüz olan gün** (Uhud savaşı günündə) **düşmənə arxa çevirib qaçdılar, (إِنَّمَا اسْتَزَلَّهُمُ الشَّيْطَانُ بِبَعْضِ مَا كَسَبُوا) - həqiqətən, o savaşdan qaçanları şeytan** (nəfsi-əmmarə) **qazandıqları bəzi günahlara görə** (peyğəmbərin itaətindən çıxmaq) **sürüşdürüb xətaya salıbdır, yoxsa özləri qəsdən savaşdan qaçmayıblar.** (Allah-Təalanın bu kəlamı adət-ənənə əsasında nazil olubdur, necə ki haqsız bir əməl edən şəxsə adətən belə deyilər: Filankəs bu əməli qəsdən etməyibdir, səhvən edib şeytan onu o işə vadar edibdir". Belə deyilir ki, o şəxs öz günahını etiraf edib tərk etsin. Allah-Təalanın kəlamı da belədir, onların savaşdan qaçmasını və Hz. Peyğəmbərin itaətindən çıxmalarını şeytanın vəsvəsəsinə isnad edir ki, onlar iqrar edib desinlər: "Bəli, bu əməl şeytandan oldu, yoxsa biz savaşdan qaçan deyildik", - bu iqrarı edib bir daha peyğəmbərin itaətindən çıxmasınlar. Hərçənd savaşdan qaçanlar qəsdən qaçmışdılar, amma onlarla bu şəkildə danışmaqda məqsəd onları hikmət üzrə itaətə gətirməkdir. İslam ümmətinin rəhbərləri Qurani-Şərifin ayələrinə diqqətlə baxıb görsünlər ki, islama müxalif olanlarla necə danışılır və rəftar edilir). **(وَلَقَدْ عَفَا اللَّهُ عَنْهُمْ) - həqiqətən, Allah-Təala əfv edib savaşdan qaçanların günahından keçdi. (إِنَّ اللَّهَ غَفُورٌ حَلِيمٌ) - həqiqətən, Allah-Təala tövbə edənləri bağışlayıb, onlara əzab etməkdə tələsən deyildir.**

**156) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) - ey iman gətirən şəxslər, (لَا تَكُونُوا كَالَّذِينَ كَفَرُوا) – kafirlər** (Abdullah ibn Übey və onun yoldaşları) **kimi olmayın ki, (وَقَالُوا لِإِخْوَانِهِمْ) - özləri kimi kafir və münafiq qardaşlarının haqqında dedilər, (إِذَا ضَرَبُوا فِي الْأَرْضِ أَوْ كَانُوا غُزًّى) – hansı ki səfərə gedəndə ölüb, ya da cihada gedib orada öldürülmüşdülər,** (bu ölənlərin, ya da öldürülənlərin haqqında belə

لَوْ كَانُوا عِنْدَنَا مَا مَاتُوا وَمَا قُتِلُوا لِيَجْعَلَ اللَّهُ ذَلِكَ حَسْرَةً فِي قُلُوبِهِمْ وَاللَّهُ يُحْيِي وَيُمِيتُ وَاللَّهُ بِمَا
تَعْمَلُونَ بَصِيرٌ ﴿١٥٦﴾ وَلَئِنْ قُتِلْتُمْ فِي سَبِيلِ اللَّهِ أَوْ مُتُّمْ لَمَغْفِرَةٌ مِنَ اللَّهِ وَرَحْمَةٌ خَيْرٌ مِمَّا يَجْمَعُونَ
﴿١٥٧﴾ وَلَئِنْ مُتُّمْ أَوْ قُتِلْتُمْ لَإِلَى اللَّهِ تُحْشَرُونَ ﴿١٥٨﴾ فَبِمَا رَحْمَةٍ مِنَ اللَّهِ لِنْتَ لَهُمْ وَلَوْ كُنْتَ
فَظًّا غَلِيظَ الْقَلْبِ لَانْفَضُّوا مِنْ حَوْلِكَ فَاعْفُ عَنْهُمْ وَاسْتَغْفِرْ لَهُمْ وَشَاوِرْهُمْ فِي الْأَمْرِ فَإِذَا عَزَمْتَ
فَتَوَكَّلْ عَلَى اللَّهِ إِنَّ اللَّهَ يُحِبُّ الْمُتَوَكِّلِينَ ﴿١٥٩﴾

---

dedilər:) **(لَوْ كَانُوا عِنْدَنَا مَا مَاتُوا وَمَا قُتِلُوا) - əgər onlar bizim yanımızda olub səfərə getməsəydilər, ölməzdilər və cihada getməsəydilər, öldürülməzdilər. (لِيَجْعَلَ اللَّهُ ذَلِكَ حَسْرَةً فِي قُلُوبِهِمْ) - münafiqlər bu sözə etiqad etdiklərinə görə. Allah-Təala onların qəlblərinə qəm və həsrət yerləşdirdi. Gərək həmişə qəm və həsrət içində olsunlar. (وَاللَّهُ يُحْيِي وَيُمِيتُ) - dirildən və öldürən Allah-Təaladır. (وَاللَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ) - və Allah-Təala etdiyiniz şeylərdən xəbərdar və görəndir.**

**157) (وَلَئِنْ قُتِلْتُمْ فِي سَبِيلِ اللَّهِ أَوْ مُتُّمْ لَمَغْفِرَةٌ مِنَ اللَّهِ وَرَحْمَةٌ خَيْرٌ مِمَّا يَجْمَعُونَ) - əgər Allah-Təala yolunda cihad etməkdə öldürülsəniz, ya da cihad yolunda səfərdə ölsəniz, sizdən ötrü evlərinizdə əyləşib dünya malı yığmaqdansa, Allah-Təaladan rəhmət və əfv edilmək daha yaxşıdır.**

**158) (وَلَئِنْ مُتُّمْ أَوْ قُتِلْتُمْ لَإِلَى اللَّهِ تُحْشَرُونَ) - əgər cihada gedən vaxt ölsəniz, ya da cihadda öldürülsəniz, əlbəttə, axirətdə Allah-Təalanın tərəfinə toplanacaqsınız. O vaxt əməllərinizin qarşılığını sizə verəcəkdir.**

**159) (فَبِمَا رَحْمَةٍ مِنَ اللَّهِ) -** (ey Məhəmməd)**, Allah-Təalanın rəhməti və yardımı sənə şamil olduğu üçün, (لِنْتَ لَهُمْ) - Uhud savaşından qaçanlara gözəl əxlaqla davrandın, sənə asi olub dağılmalarına güzəşt etdin. Onlara qəzəblənmədin. (وَلَوْ كُنْتَ فَظًّا غَلِيظَ الْقَلْبِ)-** (ey Məhəmməd)**, əgər sən qəzəbli və qatı qəlbli olsaydın, (لَانْفَضُّوا مِنْ حَوْلِكَ) - hər halda səhabələrin ətrafından dağılıb, səninlə heç kim qalmazdı.** (Sənin gözəl əxlaqındır onları saxlayan)**. (فَاعْفُ عَنْهُمْ) -** (peyğəmbərin gözəl əxlaqını təsdiq edərək, yenə təkidlə buyurur: "Ey Məhəmməd)**, onları** (Uhud savaşından qaçanları) **bağışlayıb əfv et. (وَاسْتَغْفِرْ لَهُمْ) - Allah-Təaladan onların bağışlanmasını dilə, (وَشَاوِرْهُمْ فِي الْأَمْرِ) - onlarla hərb və sair məsələlərdə məşvərət edib, onların rəyindən faydalan". (فَإِذَا عَزَمْتَ فَتَوَكَّلْ عَلَى اللَّهِ) –** (ey Məhəmməd, məşvərət edib, əksəriyyətin görüşü ilə bir rəyi seçib qərar verdiyində)**, onu etməyə əzmli olduğun zaman Allah-Təalaya təvəkkül edib o işi elə. Çünki işin əslinə Allah-Təala agahdır. (إِنَّ اللَّهَ يُحِبُّ الْمُتَوَكِّلِينَ) - həqiqətən, Allah-Təala təvəkkül edən şəxsləri sevər.**

**إِنْ يَنْصُرْكُمُ اللّٰهُ فَلَا غَالِبَ لَكُمْ وَإِنْ يَخْذُلْكُمْ فَمَنْ ذَا الَّذِي يَنْصُرُكُمْ مِنْ بَعْدِهِ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ ﴿١٦٠﴾ وَمَا كَانَ لِنَبِيٍّ أَنْ يَغُلَّ وَمَنْ يَغْلُلْ يَأْتِ بِمَا غَلَّ يَوْمَ الْقِيَامَةِ ثُمَّ تُوَفَّى كُلُّ نَفْسٍ مَا كَسَبَتْ وَهُمْ لَا يُظْلَمُونَ ﴿١٦١﴾ أَفَمَنِ اتَّبَعَ رِضْوَانَ اللّٰهِ كَمَنْ بَاءَ بِسَخَطٍ مِنَ اللّٰهِ وَمَأْوَاهُ جَهَنَّمُ وَبِئْسَ الْمَصِيرُ ﴿١٦٢﴾ هُمْ دَرَجَاتٌ عِنْدَ اللّٰهِ وَاللّٰهُ بَصِيرٌ بِمَا يَعْمَلُونَ ﴿١٦٣﴾**

---

**160)** (إِنْ يَنْصُرْكُمُ اللّٰهُ فَلَا غَالِبَ لَكُمْ وَإِنْ يَخْذُلْكُمْ فَمَنْ ذَا الَّذِي يَنْصُرُكُمْ مِنْ بَعْدِهِ وَعَلَى اللّٰهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ) **- əgər Allah-Təala sizə kömək etsə,** (Necə ki Bədir savaşında kömək etdi)**, heç bir nəfər sizə qalib gələ bilməz, əgər sizə kömək etməyi tərk etsə,** (Necə ki Uhud savaşında tərk etdi)**, Allah-Təala kömək etməyəndən sonra sizə kömək edən kimdir? Gərək möminlər hər bir işlərində Allah-Təalaya təvəkkül etsinlər.** (Uhud savaşında dağ keçidində olan oxatanlar mövqelərindən çıxıb qənimətdən ötrü gedəndə dedilər: "Gəlin gedək qənimət götürək, bəlkə, peyğəmbər qəniməti bölməyib hökm verər ki, kim nə götürübsə, o şey də onundur". Bu təmənna ilə dağdan qənimət almaq üçün gəldilər. Hz. Peyğəmbər məğlub olandan sonra onlardan soruşdu: "Siz niyə çıxıb gəldiniz?" Onlar dedilər: "Bizdən bir neçə nəfər orada qaldı, biz güman etdik ki, onlar düşmənə qarşı durmağa kifayət edərlər". Hz. Peyğəmbər buyurdu: "Belə deyil, bəlkə, siz xəyal etmisiniz ki, biz qəniməti götürüb sizin payınızı verməric. Heç vaxt belə əməl peyğəmbərə layiq deyil". O vaxt bu ayə nazil oldu.)

**161)** (وَمَا كَانَ لِنَبِيٍّ أَنْ يَغُلَّ) **- heç bir peyğəmbərə caiz deyil ki, qəniməti gizlədib cihad edənlərə verməsin.** (وَمَنْ يَغْلُلْ) **– kim qəniməti gizlətsə,** (يَأْتِ بِمَا غَلَّ يَوْمَ الْقِيَامَةِ) **- o şəxs qiyamət günündə gizlətdiyi şeyi boynuna aldığı halda, məhşərə varid olar.** (Bütün məhşər əhli onu görər). (ثُمَّ تُوَفَّى كُلُّ نَفْسٍ مَا كَسَبَتْ) **- ondan sonra hər kəsə qazandığı şeyin qarşılığı verilər.** (وَهُمْ لَا يُظْلَمُونَ) **- öz əməllərinin qarşılığı onlara verildiyi üçün onlara zülm olunmaz.**

**162)** (أَفَمَنِ اتَّبَعَ رِضْوَانَ اللّٰهِ كَمَنْ بَاءَ بِسَخَطٍ مِنَ اللّٰهِ وَمَأْوَاهُ جَهَنَّمُ وَبِئْسَ الْمَصِيرُ) **– bəs o şəxs ki Allah-Təalanın razılığına tabe olub həmişə Allah-Təalanın məmnunluğunu istəyir,** (Uhud savaşında Hz. Peyğəmbərə tabe olub möhkəm olanlar) **o şəxslər** (Uhud savaşından qaçanlar) **kimdir ki, Allah-Təala onlara qəzəbləndiyi halda, savaşdan qayıdıblar? Belə şəxslərin məkanı cəhənnəmdir və nə pis dönüləcək yerdir cəhənnəm.**

**163)** (هُمْ دَرَجَاتٌ عِنْدَ اللّٰهِ وَاللّٰهُ بَصِيرٌ بِمَا يَعْمَلُونَ) **- Allah-Təalanın məmnunluğuna tabe olub və olmayanların Allah-Təala yanında dərəcə fərqləri vardır, hər kəsin öz əməlinə görə onunla rəftar olunacaqdır. Allah-Təala edilən şeylərdən agahdır və görəndir.**

لَقَدْ مَنَّ اللَّهُ عَلَى الْمُؤْمِنِينَ إِذْ بَعَثَ فِيهِمْ رَسُولًا مِنْ أَنْفُسِهِمْ يَتْلُو عَلَيْهِمْ آيَاتِهِ وَيُزَكِّيهِمْ وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَإِنْ كَانُوا مِنْ قَبْلُ لَفِي ضَلَالٍ مُبِينٍ ﴿١٦٤﴾ أَوَلَمَّا أَصَابَتْكُمْ مُصِيبَةٌ قَدْ أَصَبْتُمْ مِثْلَيْهَا قُلْتُمْ أَنَّى هَذَا

---

**164) (لَقَدْ مَنَّ اللَّهُ عَلَى الْمُؤْمِنِينَ) - həqiqətən, Allah-Təala möminlərə böyük minnət qoyubdur. (إِذْ بَعَثَ فِيهِمْ رَسُولًا مِنْ أَنْفُسِهِمْ) - o səbəbə görə ki, onların arasından özləri kimi bir insanı** (Hz. Məhəmməd ə.s) **onlara peyğəmbər göndərdi.** (Gərək, belə böyük bir nemətə şükür etsinlər). **(يَتْلُو عَلَيْهِمْ آيَاتِهِ) - o peyğəmbər** (Hz. Məhəmməd) **Allah-Təaladan gələn Qurani-Şərifin* ayələrini onlara oxuyub öyrədir ki, onları cəhalətdən xilas etsin. (وَيُزَكِّيهِمْ) – və onları küfr və xəbis olan əməllərdən pak və təmiz etsin. (وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ) – Qurani-Şərifi və öz ağlı ilə vəz etdiyi qanun və hikmətləri xalqa öyrədir. (وَإِنْ كَانُوا مِنْ قَبْلُ لَفِي ضَلَالٍ مُبِينٍ) - hərçənd bu peyğəmbərdən** (Hz. Məhəmməddən) **qabaq xalq açıq-aşkar zəlalətdə idi, amma indi bu peyğəmbərə görə, tamamən hidayət tapıb zəlalətdən xilas ola bilər.** (Əfsus ki, dövrümüzdə biz müsəlmanlar Qurani-Şərifdən və o həzrətin hikmətamiz sözlərindən qafil olub, nəfsani arzulara tabe olub cahiliyyə zamanından betər zəlalətə düçar olmuşuq).

*(****Qeyd:*** *Uca peyğəmbərimizin peyğəmbərliyinin isbatına Allah-Təala bu Qurani-Şərifi dəlil göstəribdir. Hz. Peyğəmbər insanları hiyləbazlıq və oyunbazlıq ilə aldatmayıb, ondan möcüzə istəyənlərə deyərdi: "Mənim möcüzəm Allah-Təala tərəfindən gətirdiyim bu Qurani-Şərifdir, əgər qüdrətiniz varsa, bu Quran surələri kimi bir surə gətirin". Bütün ərəb ədibləri aciz qaldılar, onun düşmənlərinin əgər qüdrətləri olsaydı, əlbəttə, onun cavabını verib yalançı olduğunu isbat edərdilər. Qurani-Şərifdən başqa, o həzrətdən nə möcüzə istəyiblərsə, hamısını inkar edib cavabında deyib ki, bunların heç biri məndən meydana gəlməz. Amma o möcüzələr ki, kitablarda nəql ediblər, guya Hz. Peyğəmbərdən möcüzə istəyəndə o möcüzələri izhar edibdir. Onlara inanıb etiqad edən şəxs gərək Qurani-Şərifi təkzib etsin. Çünki Qurani-Şərifdə bir neçə yerdə qeyd olunub ki, belə buyurur: "Ey Məhəmməd, o möcüzələr ki, səndən istəyirlər, de ki, onların heç biri məndən meydana gəlməz, mən insanam, Allah-Təala tərəfindən sizə peyğəmbər gəlmişəm ki, Allah-Təalanın kəlamını və ehkamını sizə bildirim". O möcüzələr ki, Hz. Peyğəmbərə isnad edirlər, bunu düşünmürlər ki, hansı möcüzə Qurani-Şərifdən üstün ola bilər? Ağıl ona heyrandır. Bu mətləb, inşaallah, bundan sonra gələn surələrdə, xüsusən, Bəni-İsrail (İsra) surəsində bəyan olunacaqdır).*

**165) (أَوَلَمَّا أَصَابَتْكُمْ مُصِيبَةٌ) - Uhud savaşında siz müsəlmanlara müşriklərdən müsibət gəldiyində,** (Uhud savaşında müsəlmanlardan 70 nəfər şəhid oldu), **(قَدْ أَصَبْتُمْ مِثْلَيْهَا) - halbuki Bədir savaşında bu müsibətin iki qatını siz müşriklərə etmişdiniz, (Bədir savaşında müsəlmanlar müşriklərdən 70 nəfəri qətlə yetirib, 70 nəfəri əsir tutmuşdular). (قُلْتُمْ أَنَّى هَذَا) - belə olan**

قُلْ هُوَ مِنْ عِنْدِ أَنْفُسِكُمْ إِنَّ اللهَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٦٥﴾ وَمَا أَصَابَكُمْ يَوْمَ الْتَقَى الْجَمْعَانِ فَبِإِذْنِ اللهِ
وَلِيَعْلَمَ الْمُؤْمِنِينَ ﴿١٦٦﴾ وَلِيَعْلَمَ الَّذِينَ نَافَقُوا وَقِيلَ لَهُمْ تَعَالَوْا قَاتِلُوا فِي سَبِيلِ اللهِ أَوِ ادْفَعُوا قَالُوا لَوْ
نَعْلَمُ قِتَالًا لَاتَّبَعْنَاكُمْ هُمْ لِلْكُفْرِ يَوْمَئِذٍ أَقْرَبُ مِنْهُمْ لِلْإِيمَانِ يَقُولُونَ بِأَفْواهِهِمْ مَا لَيْسَ فِي قُلُوبِهِمْ وَاللهُ
أَعْلَمُ بِمَا يَكْتُمُونَ ﴿١٦٧﴾

---

**halda, siz müsəlmanlar dediniz: "Bəs bu müsibət bizə haradan gəldi?" (قُلْ هُوَ مِنْ عِنْدِ أَنْفُسِكُمْ) -** (ey Məhəmməd), **onlara de ki, o müsibət sizə özünüzdən gəldi.** (Hz. Peyğəmbər əvvəlcə Mədinədən çıxmağa razı deyildi, şura məclisində əksəriyyətin səsi ilə onu oradan çıxmağa vadar etdiniz. İkincisi, dağ keçidində sizdən 50 nəfər oxatan yerləşdirib buyurdu: "Biz qalib olsaq, ya da uduzsaq, siz buradan hərəkət etməyin". Amma onlar elə ki müsəlmanların qalib gəldiyini gördülər, qənimət tamahı ilə oranı boş qoyub savaş meydanına getdilər, bu iki məsələ sizin məğlub olmanıza səbəb oldu). **(إِنَّ اللهَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) - həqiqətən, Allah-Təala hər bir şeyə** (sizi gah qalib, gah məğlub etməyə) **qadirdir.**

**166) (وَمَا أَصَابَكُمْ يَوْمَ الْتَقَى الْجَمْعَانِ فَبِإِذْنِ اللهِ وَلِيَعْلَمَ الْمُؤْمِنِينَ) - Uhud savaşında iki camaat** (möminlər və müşriklər) **qarşılaşan zaman siz möminlərə gələn hər bir müsibət Allah-Təalanın izni ilədir. Sizin qabaqca qeyd olunan əməllərinizə görə, Allah-Təala sizə kömək etmədi. Ta ki imanlarında möhkəm olub olmayanları bir-birindən ayırd edib məlum etsin.**

**167) (وَلِيَعْلَمَ الَّذِينَ نَافَقُوا) - bir də bu müsibət sizə ona görə gəldi ki, münafiq olan şəxslər məlum olsun.** (Necə ki məlum oldu, Abdullah ibn Übey və onun yoldaşları nifaqlarını izhar etdilər). **(وَقِيلَ لَهُمْ تَعَالَوْا قَاتِلُوا فِي سَبِيلِ اللهِ) - möminlər münafiqlərə dedilər: "Gəlin Allah-Təala yolunda cihad edin. (أَوِ ادْفَعُوا) – ya da əgər savaşmasanız da, qoşunu çox göstərməklə düşməni dəf edin". (قَالُوا) - münafiqlər dedilər: (لَوْ نَعْلَمُ قِتَالًا لَاتَّبَعْنَاكُمْ) - "Əgər biz bu savaşı Allah-Təala yolunda cihad edə bilsək, sizə kömək olub savaşarıq, amma bu cihad deyil, bəlkə, özünüzü məhv etməkdir. O səbəbdən biz bu savaşda iştirak etmərik".** (Abdullah ibn Übeyin rəyi Mədinədə qalmaq olduğundan savaşdan qaçdı). **(هُمْ لِلْكُفْرِ يَوْمَئِذٍ أَقْرَبُ مِنْهُمْ لِلْإِيمَانِ) - ey möminlər, münafiqlərə bu sözləri demək lazım deyil, onlar bu gün kafirliyə möminlikdən yaxındırlar.** (Uhud savaşından qabaq imanı izhar edirdilər, amma o gün nifaqlarını aşkar etdilər). **(يَقُولُونَ بِأَفْواهِهِمْ مَا لَيْسَ فِي قُلُوبِهِمْ) - bu münafiqlər ağızları ilə o sözləri deyirlər ki, qəlbləri ondan xəbərdar deyildir.** (Ağızları ilə deyirlər: "İman edirik," amma qəlblərində əsla iman yoxdur). **(وَاللهُ أَعْلَمُ بِمَا يَكْتُمُونَ) - Allah-Təala onların qəlblərində gizlətdikləri nifaqlarından agahdır.**

الَّذِينَ قَالُوا لِإِخْوَانِهِمْ وَقَعَدُوا لَوْ أَطَاعُونَا مَا قُتِلُوا قُلْ فَادْرَءُوا عَنْ أَنْفُسِكُمُ الْمَوْتَ إِنْ كُنْتُمْ صَادِقِينَ
﴿١٦٨﴾ وَلَا تَحْسَبَنَّ الَّذِينَ قُتِلُوا فِي سَبِيلِ اللَّهِ أَمْوَاتًا بَلْ أَحْيَاءٌ عِنْدَ رَبِّهِمْ يُرْزَقُونَ ﴿١٦٩﴾ فَرِحِينَ بِمَا
آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ وَيَسْتَبْشِرُونَ بِالَّذِينَ لَمْ يَلْحَقُوا بِهِمْ مِنْ خَلْفِهِمْ أَلَّا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ
﴿١٧٠﴾ يَسْتَبْشِرُونَ بِنِعْمَةٍ مِنَ اللَّهِ وَفَضْلٍ وَأَنَّ اللَّهَ لَا يُضِيعُ أَجْرَ الْمُؤْمِنِينَ ﴿١٧١﴾

---

**168) (**الَّذِينَ قَالُوا لِإِخْوَانِهِمْ وَقَعَدُوا لَوْ أَطَاعُونَا مَا قُتِلُوا قُلْ فَادْرَءُوا عَنْ أَنْفُسِكُمُ الْمَوْتَ إِنْ كُنْتُمْ صَادِقِينَ**) - o münafiqlər ki, özləri cihadı tərk edib** (Uhud savaşında) **şəhid olan qardaşlarının** (yəni soy baxımından qardaş olan və onların tayfasından olanlar) **haqqında dedilər: "Əgər onlar bizə itaət edib savaşa getməsəydilər, hər halda öldürülməzdilər".** (ey Məhəmməd)**, onlara de ki, əgər bu sözünüzdə sadiqsinizsə, ölümü özünüzdən dəf edin ki, ölməyəsiniz, halbuki siz də öləcəksiniz.** (Belə olan halda cihad meydanında ölmək başqa cür ölməkdən yaxşıdır)**.**

**169)* (**وَلَا تَحْسَبَنَّ الَّذِينَ قُتِلُوا فِي سَبِيلِ اللَّهِ أَمْوَاتًا بَلْ أَحْيَاءٌ عِنْدَ رَبِّهِمْ يُرْزَقُونَ**) - ey cihaddan qaçan şəxslər,**

*(****Qeyd:*** *Bu ayələr işarə edir ki, insan öləndən sonra ruhu əbədidir, ondan ötrü yoxluq yoxdur, ruh ya nemət içində, ya da əzab içində olacaqdır. Quran əhli gərək Qurana etiqad etsin, materialistlərin sözlərinə və etiqadlarına qulaq asmasın, bütün peyğəmbərlər ruhun əbədiliyini xəbər veriblər. Peyğəmbərlərin sözlərini qoyub sair şəxslərin sözlərinə inanmaq böyük xətadır).*

**o şəxslər ki Allah-Təala yolunda şəhid olublar, onları ölü güman etməyin, əksinə, onlar diridir, öz rəbləri Allah-Təala yanında hər cür ruzi onlara bəxş edilər.**

**170) (**فَرِحِينَ بِمَا آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ**) - şəhid olan şəxslər şəhid olduqlarına görə, Allah-Təalanın lütf və rəhmətindən onlara bəxş etdiyi nemətlərə sevinərlər. (**وَيَسْتَبْشِرُونَ بِالَّذِينَ لَمْ يَلْحَقُوا بِهِمْ مِنْ خَلْفِهِمْ**) - dünyada qalan mömin qardaşlarından ötrü də - hansı ki cihadla məşğul olub hələ şəhid olub onlara qoşulmayıblar, şadlıq edərlər. (**أَلَّا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ**) -** (o şadlığı ona görə edirlər ki, Allah-Təala onlara bildiribdir ki, dünyada qalıb cihad edən mömin qardaşlarından ötrü) **qiyamət günündə Allah-Təalanın əzabından nə qorxu vardır, nə də qəmgin olmazlar.**

**171) (**يَسْتَبْشِرُونَ بِنِعْمَةٍ مِنَ اللَّهِ وَفَضْلٍ وَأَنَّ اللَّهَ لَا يُضِيعُ أَجْرَ الْمُؤْمِنِينَ**) - bir də şəhid olanlar o nemətlərə görə şadlıq edərlər ki, Allah-Təala öz lütf və rəhmətindən o nemətləri onların dünyada cihad edən qardaşlarına öləndən sonra bəxş edəcəkdir. Həqiqətən, Allah-Təala möminlərin əcr, savablarını puç edən deyildir.** (Əbu Süfyan və Qüreyş camaatı Uhuddan Məkkəyə qayıdanda, elə ki Revha adlı yerə yetişdilər, peşman olub Mədinəyə tərəf geri dönmək

**الَّذِينَ اسْتَجَابُوا لِلَّهِ وَالرَّسُولِ مِنْ بَعْدِ مَا أَصَابَهُمُ الْقَرْحُ لِلَّذِينَ أَحْسَنُوا مِنْهُمْ وَاتَّقَوْا أَجْرٌ عَظِيمٌ**
**﴿١٧٢﴾ الَّذِينَ قَالَ لَهُمُ النَّاسُ إِنَّ النَّاسَ قَدْ جَمَعُوا لَكُمْ فَاخْشَوْهُمْ فَزَادَهُمْ إِيمَانًا**

---

istədilər. Hz. Peyğəmbər bu mətləbdən xəbərdar olub istədi ki, Qüreyş camaatını qorxudub öz gücünü onlara bildirsin. Əmr etdi ki, Qüreyşin dalınca getmək üçün qoşun hazırlaşsın. Əmr etdi ki, kim Uhud savaşında bizimlə birlikdə idi, onlar gəlsinlər. Onlardan başqa, heç kim gəlməsin. Səhabələr elə yaralı halda özlərində güc tapıb yola düşdülər. Həmraül-əsəd adlı yerə çatdılar. Oradan Mədinəyə 8 mil yol idi. Orada peyğəmbərə müşriklərin qayıdıb Məkkəyə getdikləri xəbəri gəldi, Hz. Peyğəmbər də oradan Mədinəyə qayıtdı. O vaxt bu ayə nazil oldu).

**172) (الَّذِينَ اسْتَجَابُوا لِلَّهِ وَالرَّسُولِ مِنْ بَعْدِ مَا أَصَابَهُمُ الْقَرْحُ)- o şəxslər ki Uhud savaşında yaralanandan sonra Allah-Təalanın və peyğəmbərin sözünü qəbul edib müşriklərin dalınca getdilər, (لِلَّذِينَ أَحْسَنُوا مِنْهُمْ وَاتَّقَوْا) - o şəxslər ki yaxşı əməl edərək təqva edib peyğəmbərə itaət etdilər, (أَجْرٌ عَظِيمٌ) - onlardan ötrü Allah-Təalanın qatında böyük əcr və savab vardır.** (Elə ki Uhud savaşı bitdi, müşriklərin rəisi Əbu Süfyan ibn Hərb səsləndi: “Ey Məhəmməd, əgər yenə savaşmaq istəsən, vəd yerimiz gələn il Bədirdə olsun”. Hz. Peyğəmbər buyurdu: “İnşallah”. O zaman ki vəd edilən vaxt gəldi, Əbu Süfyan Məkkə əhlini toplayıb, Məkkədən çıxıb Mərrüz-Zəhran adlı yerdə qərargah qurdu. Allah-Təala onların qəlbinə qorxu saldı istədilər qayıtsınlar, Əbu Süfyan əl-Əşca camaatından Nüeym ibn Məsudini görüb dedi: “Ey Nüeym, mən Məhəmməd ilə vədləşmişəm ki, bu il Bədirə gedib onunla savaşaq, amma bu il yaxşı il deyildir, qəhətlik ilidir, savaşa getmək istəmirəm, amma əgər Məhəmməd Bədirə gəlsə, mən getməsəm, onun cürəti artar. Sən Mədinəyə gedib onları Mədinədən çıxmağa qoyma, sənə 10 ədəd dəvə verərəm”. Nüeym oradan Mədinəyə gəlib gördü ki, müsəlmanlar savaşa hazırlaşırlar. Dedi: Bu nə xəyaldır edirsiniz, keçən il Qüreyş sizin vilayətinizə gəlib sizi qətlə yetirdi, indi yenə onlara tərəf gedirsiniz? Sayları o qədərdir ki, sizdən heç kim xilas olmaz”. Müsəlmanlar onun sözünə qulaq asmayıb dedilər: “Allah-Təala bizim vəkilimizdir”. Hz. Peyğəmbər mühacirlər və xristianlar ilə Bədirə gedib 8 gün orada qalıb alış-veriş etdi. Ərəbistanda hər zaman bir yerdə bazar qurulardı. O zaman da Bədirdə bazar qurulmuşdu. Oradan sağ-salamat Mədinəyə qayıtdılar. O vaxt bu ayə nazil oldu).

**173) (الَّذِينَ قَالَ لَهُمُ النَّاسُ) - o möminlər ki,** (Nüeym ibn Məsud) **onlara belə demişdi: (إِنَّ النَّاسَ قَدْ جَمَعُوا لَكُمْ فَاخْشَوْهُمْ)- “Həqiqətən, Məkkəli Qüreyş əhli sizdən ötrü toplanıb, onlardan qorxub savaşa getməyin”. (فَزَادَهُمْ إِيمَانًا) –o şəxsin sözündən onlar** (möminlər) **qorxmayıb, hətta imanları artırıb**

وَقَالُوا حَسْبُنَا اللَّهُ وَنِعْمَ الْوَكِيلُ ﴿١٧٣﴾ فَانْقَلَبُوا بِنِعْمَةٍ مِنَ اللَّهِ وَفَضْلٍ لَمْ يَمْسَسْهُمْ سُوءٌ وَاتَّبَعُوا
رِضْوَانَ اللَّهِ وَاللَّهُ ذُو فَضْلٍ عَظِيمٍ ﴿١٧٤﴾ إِنَّمَا ذَلِكُمُ الشَّيْطَانُ يُخَوِّفُ أَوْلِيَاءَهُ فَلَا تَخَافُوهُمْ
وَخَافُونِ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿١٧٥﴾ وَلَا يَحْزُنْكَ الَّذِينَ يُسَارِعُونَ فِي الْكُفْرِ إِنَّهُمْ لَنْ يَضُرُّوا اللَّهَ
شَيْئًا يُرِيدُ اللَّهُ أَلَّا يَجْعَلَ لَهُمْ حَظًّا فِي الْآخِرَةِ وَلَهُمْ عَذَابٌ عَظِيمٌ ﴿١٧٦﴾ إِنَّ الَّذِينَ اشْتَرَوُا الْكُفْرَ
بِالْإِيمَانِ لَنْ يَضُرُّوا اللَّهَ شَيْئًا وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿١٧٧﴾

---

**cihad işində möhkəm olub getməyə əzm etdilər. (وَقَالُوا حَسْبُنَا اللَّهُ وَنِعْمَ الْوَكِيلُ) - dedilər: "Allah-Təala bizə kifayət edər, işimizi Ona həvalə etməkdən ötrü O nə yaxşı vəkildir,** (biz öz işlərimizi ona həvalə edib, cihad işində möhkəm olduq)".

**174) (فَانْقَلَبُوا بِنِعْمَةٍ مِنَ اللَّهِ وَفَضْلٍ) - Allah-Təalanın ehsan və neməti ilə özləri sağ-salamat, alış-verişlərində mənfəət əldə edib, düşmən də onlardan qorxmuş halda Bədirdən qayıdıb Mədinəyə döndülər. (لَمْ يَمْسَسْهُمْ سُوءٌ) – elə bir halda qayıtdılar ki, onlara heç bir əziyyət toxunmadı. (وَاتَّبَعُوا رِضْوَانَ اللَّهِ) - cürət edib Qüreyşlə savaşa getdiklərinə görə Allah-Təalanın məmnunluğuna tabe oldular. (وَاللَّهُ ذُو فَضْلٍ عَظِيمٍ) - Allah-Təala böyük lütf və bəxşiş sahibidir.**

**175) (إِنَّمَا ذَلِكُمُ الشَّيْطَانُ يُخَوِّفُ أَوْلِيَاءَهُ فَلَا تَخَافُوهُمْ وَخَافُونِ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ) - həqiqətən, sizi bu savaşdan saxlayan və qorxudan** (Nüeym ibn Məsud) **şeytandır, sizi öz dostları Əbu Süfyan və onun qoşunu ilə qorxudur, əgər möminsinizsə, onlardan qorxmayın, məndən qorxub peyğəmbərimə itaət edib onunla savaşa gedin.**

**176) (وَلَا يَحْزُنْكَ الَّذِينَ يُسَارِعُونَ فِي الْكُفْرِ) - imandan keçib küfrə can atanlar** (Uhud savaşından qaçan münafiqlər) **səni məhzun və qəmgin etməsin. (إِنَّهُمْ لَنْ يَضُرُّوا اللَّهَ شَيْئًا) - həqiqətən, o münafiqlər Allah-Təalaya heç bir zərər yetirə bilməzlər. Zərərləri ancaq özlərinə aid olar. (يُرِيدُ اللَّهُ أَلَّا يَجْعَلَ لَهُمْ حَظًّا فِي الْآخِرَةِ) - nifaq və küfrlərində o qədər tüğyan ediblər ki, Rəhman və Rəhim olan Allah-Təala onlara küfrlərinə görə axirətdə heç bir əcr və savab vermək istəmir. (وَلَهُمْ عَذَابٌ عَظِيمٌ) - onlardan ötrü savab əvəzinə böyük əzab vardır.**

**177) (إِنَّ الَّذِينَ اشْتَرَوُا الْكُفْرَ بِالْإِيمَانِ لَنْ يَضُرُّوا اللَّهَ شَيْئًا وَلَهُمْ عَذَابٌ أَلِيمٌ) - həqiqətən, o münafiqlər ki imanın əvəzinə küfrü alıblar, əlbəttə, Allah-Təalaya bir zərər verə bilməzlər. Onlardan ötrü axirətdə çox şiddətli əzab vardır.** (Uhud savaşı haqqında nazil olan* ayələr bitdi).

*(****Qeyd:** Uhud savaşı haqda, nazil olan bu ayələrin məqsədi həmin savaş əhvalatını bizə xəbər verməkdir. Hər bir ayənin ehtivasında bir çox dərin mənalar var. Bəsirətli və dinpərəst şəxslərdən ötrü bu ayələrdə nə böyük dəlillər vardır. İman və*

**وَلَا يَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا أَنَّمَا نُمْلِي لَهُمْ خَيْرٌ لِأَنْفُسِهِمْ إِنَّمَا نُمْلِي لَهُمْ لِيَزْدَادُوا إِثْمًا وَلَهُمْ عَذَابٌ مُهِينٌ ﴿١٧٨﴾ مَا كَانَ اللَّهُ لِيَذَرَ الْمُؤْمِنِينَ عَلَى مَا أَنْتُمْ عَلَيْهِ حَتَّى يَمِيزَ الْخَبِيثَ مِنَ الطَّيِّبِ وَمَا كَانَ اللَّهُ لِيُطْلِعَكُمْ عَلَى الْغَيْبِ وَلَكِنَّ اللَّهَ يَجْتَبِي مِنْ رُسُلِهِ مَنْ يَشَاءُ فَآمِنُوا بِاللَّهِ وَرُسُلِهِ وَإِنْ تُؤْمِنُوا وَتَتَّقُوا فَلَكُمْ أَجْرٌ عَظِيمٌ ﴿١٧٩﴾**

---

*nifaqın əlamətləri bu ayələrdən məlum olur. Bəzi ayələrin təfsirində bəyan olundu. Bəzisinə də işarə olundu. Bu kitabda işarə olunanlara, ayələrin mənasına dürüst diqqət etsinlər. O vaxt bir çox dərin mənalar onlara məlum olar, hərçənd bu kitab türk dilindədir, türk dilində o qədər imkan yoxdur ki, müşkül olan mətləbləri ifadə etsin, amma bununla belə, bir çox dərin mənaları bu kitabda qeyd etmişəm. Ağıl sahiblərinin diqqət etməsi tövsiyə olunur).*

**178) (وَلَا يَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا)** - (ey Məhəmməd)**, bu kafirlər güman etməsinlər ki, (أَنَّمَا نُمْلِي لَهُمْ خَيْرٌ لِأَنْفُسِهِمْ)- həqiqətən, onlara möhlət verməmiz, onların dünyada ləzzət almaları onların özündən ötrü xeyirli bir şeydir. Onlar belə güman etsələr də, belə deyil. (إِنَّمَا نُمْلِي لَهُمْ) - bəlkə, həqiqətən, biz kafirlərə möhlət vermişik ki, (لِيَزْدَادُوا إِثْمًا) - uzun ömür səbəbinə özlərindən ötrü günahlarını artırsınlar, (وَلَهُمْ عَذَابٌ مُهِينٌ) - o günahın səbəbinə onlardan ötrü axirətdə son dərəcə həqir və zəlil edici əzab vardır.** (Hz. Peyğəmbərin zamanında möminlər və münafiqlər bir-birilərinə qarışıb, ayırd edilmirdilər. O barədə aşağıdakı bu ayə nazil oldu).

**179) (مَا كَانَ اللَّهُ لِيَذَرَ الْمُؤْمِنِينَ) - Allah-Təala siz möminləri belə qoyan deyil, (عَلَى مَا أَنْتُمْ عَلَيْهِ) – indi olduğunuz hal üzrə (möminlərlə münafiqlər bir-birilərinə qarışıb, mömin münafiqdən ayırd edilməsin). (حَتَّى يَمِيزَ الْخَبِيثَ مِنَ الطَّيِّبِ) – sizi bu halda qoymaz, xəbis və münafiq olan şəxsi pak və mömin olan şəxsdən fərqləndirib ayırsın.** (Necə ki Uhud savaşında məlum oldu, münafiqlər nifaqlarını aşkar edib savaşdan qaçdılar)**. (وَمَا كَانَ اللَّهُ لِيُطْلِعَكُمْ عَلَى الْغَيْبِ) - Allah-Təala siz insanları qeyb elmindən agah və xəbərdar edən deyildir.** (Qeyb elmi Allah-Təalaya məxsusdur)**. (وَلَكِنَّ اللَّهَ يَجْتَبِي مِنْ رُسُلِهِ مَنْ يَشَاءُ) - lakin Allah-Təala qeyb elmindən ötrü öz peyğəmbərlərindən istədiyini seçər,** (ona qeyb elmini öyrədər, qeyb elmi ancaq Allah-Təalaya məxsusdur). (Əgər sizdən biri qeyb elmini bilmə iddiasında olsa, onun iddiası batildir)**. (فَآمِنُوا بِاللَّهِ وَرُسُلِهِ) - Allah-Təalaya və onun peyğəmbərlərinə iman gətirin.** (Allah-Təalaya iman gətirin ki, O şəriksiz və qeybdən agahdır. İman gətirin onun peyğəmbərlərinə ki, seçilmiş bəndələrdirlər. Onların verdiyi hər bir elm və xəbər ancaq Allah-Təaladandır. Bildirdikləri qeyb xəbərləri də ancaq Allah-Təaladandır). **(وَإِنْ تُؤْمِنُوا وَتَتَّقُوا) - əgər siz münafiqlər də iman gətirib qorxsanız, (فَلَكُمْ أَجْرٌ عَظِيمٌ) - sizdən ötrü Allah-Təala qatında böyük əcr, savab olacaqdır.**

وَلَا يَحْسَبَنَّ الَّذِينَ يَبْخَلُونَ بِمَا آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ هُوَ خَيْرًا لَهُمْ بَلْ هُوَ شَرٌّ لَهُمْ سَيُطَوَّقُونَ مَا بَخِلُوا بِهِ يَوْمَ الْقِيَامَةِ وَلِلَّهِ مِيرَاثُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ ﴿١٨٠﴾ لَقَدْ سَمِعَ اللَّهُ قَوْلَ الَّذِينَ قَالُوا إِنَّ اللَّهَ فَقِيرٌ وَنَحْنُ أَغْنِيَاءُ سَنَكْتُبُ مَا قَالُوا وَقَتْلَهُمُ الْأَنْبِيَاءَ بِغَيْرِ حَقٍّ وَنَقُولُ ذُوقُوا عَذَابَ الْحَرِيقِ ﴿١٨١﴾ ذَلِكَ بِمَا قَدَّمَتْ أَيْدِيكُمْ وَأَنَّ اللَّهَ لَيْسَ بِظَلَّامٍ لِلْعَبِيدِ ﴿١٨٢﴾

---

**180) (وَلَا يَحْسَبَنَّ الَّذِينَ يَبْخَلُونَ بِمَا آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ هُوَ خَيْرًا لَهُمْ) - o şəxslər ki Allah-Təala onlara öz lütf və rəhmətindən dünya malı verib, onlar isə xəsislik edib Allah-Təala yolunda sədəqə və ehsan vermirlər, belə şəxslər güman etməsinlər ki, bu xəsislik onlardan ötrü yaxşı bir əməldir. (بَلْ هُوَ شَرٌّ لَهُمْ) - bəlkə onlardan ötrü pis bir əməldir. (سَيُطَوَّقُونَ مَا بَخِلُوا بِهِ يَوْمَ الْقِيَامَةِ) - əlbəttə, o xəsislik etdikləri mal qiyamət günündə onların boynunda elə bir halqa olacaqdır ki, onun ağırlığından üzüüstə diriləcəklər. (وَلِلَّهِ مِيرَاثُ السَّمَاوَاتِ وَالْأَرْضِ) - səmalarda və yerdə olan şeylərin mirası Allah-Təalaya məxsusdur.** (Bütün məxluqat ölüb, onlarda olan hər bir şeyə Allah-Təala sahib olacaqdır. Bəs nəyə görə dünya malında xəsislik edib Allah-Təala yolunda sədəqə vermirsiniz?) **(وَاللَّهُ بِمَا تَعْمَلُونَ خَبِيرٌ) - halbuki etdiyiniz hər bir əməldən Allah-Təala xəbərdardır.** (Hz. Peyğəmbər səhabələrindən Əbu Bəkiri bəni-Qaynuqa yəhudilərinə göndərdi ki, onları islama, namaz qılıb zəkat və borcu gözəl şəkildə verməyə dəvət etsin. Əbu Bəkir getdi Hz. Peyğəmbərin fərmanını onlara bildirib islama dəvət etdi, onların alimlərindən Fənhas Azura oğlu dedi: "Ey Əbu Bəkir, Allah-Təala bizdən borc istəyir, belə məlum olur ki, Allah-Təala kasıb, biz isə varlıyıq". Əbu Bəkir bu sözdən qəzəblənib, onun üzünə bir sillə vurub dedi: "Əgər bizimlə sizin aranızda əhd və müqavilə olmasaydı, hər halda bu küfr sözə görə səni qətlə yetirərdim". Fənhas Hz. Peyğəmbərin hüzuruna gəlib Əbu Bəkirdən şikayət edib dediyi sözü inkar etdi. O vaxt bu ayə nazil oldu).

**181) (لَقَدْ سَمِعَ اللَّهُ) - həqiqətən, Allah-Təala eşitdi, (قَوْلَ الَّذِينَ قَالُوا إِنَّ اللَّهَ فَقِيرٌ وَنَحْنُ أَغْنِيَاءُ) - o şəxslərin sözlərini ki, həqiqətən, Allah-Təala yoxsul, biz isə varlı şəxslərik, demişdilər. (sənəktubu ma qalu (سَنَكْتُبُ مَا قَالُوا) - əlbəttə, onların bu sözlərini yazıb təsbit edərik. (Əbu Bəkir doğru deyir: Fənhas yalandan inkar edir). (وَقَتْلَهُمُ الْأَنْبِيَاءَ بِغَيْرِ حَقٍّ) - bu yəhudilərin ata-babalarının peyğəmbərləri qətlə yetirmələrinə razı olduqlarını da bu sözləri ilə birlikdə qeyd edirik. (وَنَقُولُ ذُوقُوا عَذَابَ الْحَرِيقِ) - qiyamət günündə onlara deyərik: "Bu yandıran odun** (cəhənnəm odunun) **əzabını dadın.**

**182) (ذَلِكَ بِمَا قَدَّمَتْ أَيْدِيكُمْ) - bu əzab əvvəlcədən dünyada əllərinizlə etdiyiniz o əməllərə görədir".** (Yəni peyğəmbərləri qətl etmək, Allah-Təalaya yoxsulluq isnad etmək və bunlardan başqa əməllər əllə edildiyinə görə ayədə onların əməli ələ isnad edildi). **(وَأَنَّ اللَّهَ لَيْسَ بِظَلَّامٍ لِلْعَبِيدِ) - həqiqətən, Allah-Təala**

الَّذِينَ قَالُوا إِنَّ اللهَ عَهِدَ إِلَيْنَا أَلَّا نُؤْمِنَ لِرَسُولٍ حَتَّى يَأْتِيَنَا بِقُرْبَانٍ تَأْكُلُهُ النَّارُ قُلْ قَدْ جَاءَكُمْ رُسُلٌ مِنْ قَبْلِي بِالْبَيِّنَاتِ وَبِالَّذِي قُلْتُمْ فَلِمَ قَتَلْتُمُوهُمْ إِنْ كُنْتُمْ صَادِقِينَ ﴿١٨٣﴾ فَإِنْ كَذَّبُوكَ فَقَدْ كُذِّبَ رُسُلٌ مِنْ قَبْلِكَ

---

**bəndələrinə zülm edən deyildir.** (Yəhudilərin rəislərindən bir neçə nəfər Hz. Peyğəmbərin hüzuruna gəlib dedi ki, Allah-Təala Tövratda bizə belə buyurubdur: "Sizə səmadan gələn bir odun yandırıb yox etdiyi bir qurban gətirməyən heç bir peyğəmbərə iman gətirməyin. Bizə səmadan gələn bir odun yandırıb yox etmədiyi bir qurban gətirməsən, sənə iman gətirmərik. Ancaq o vaxt sənə iman edərik". Bu barədə bu ayə nazil oldu).

**183) (الَّذِينَ قَالُوا)** – (ey Məhəmməd)**, o yəhudilər ki, sənə demişdilər: (إِنَّ اللهَ عَهِدَ إِلَيْنَا) - həqiqətən, Allah-Təala biz yəhudilərə Tövrat kitabında əhd edibdir ki, (أَلَّا نُؤْمِنَ لِرَسُولٍ) - gərək, heç bir peyğəmbərə iman gətirməyək. (حَتَّى يَأْتِيَنَا بِقُرْبَانٍ تَأْكُلُهُ النَّارُ) – ta ki o peyğəmbər səmadan bir odun gəlib onu yandıracağı** (yeyəcəyi) **bir qurban gətirsin. O vaxt biz ona iman gətirərik.** (Ey Məhəmməd, sən də əgər belə bir qurban gətirsən, sənə iman gətirərik. Allah-Təala buyurur:) **(قُلْ قَدْ جَاءَكُمْ رُسُلٌ مِنْ قَبْلِي بِالْبَيِّنَاتِ) - həqiqətən, sizə məndən əvvəl aşkar olan möcüzələrlə peyğəmbərlər gəldilər. (وَبِالَّذِي قُلْتُمْ) - bir də həmin bu möcüzə ki siz deyirsiniz, bu möcüzəni də gətirdilər. (فَلِمَ قَتَلْتُمُوهُمْ) - bəs niyə** (ata-babalarınız) **o peyğəmbərləri qətlə yetirib iman gətirmədiniz? (إِنْ كُنْتُمْ صَادِقِينَ) - əgər doğru deyirsinizsə, o peyğəmbərləri niyə qətlə yetirirdilər?** (Gərək, sizin ata-babalarınız o peyğəmbərlərə iman gətirəydilər, siz də onların əməllərinə razı olduğunuzdan imansız hesab olunursunuz. Bir də möcüzə adətdən kənar olan bir şeydir ki, insan o şeyi etməyə aciz olar, mənim möcüzəm bu Qurani-Şərifdir. Onun bənzərini gətirin, madam ki aciz qaldınız, bilin ki, o, Allah-Təala tərəfindəndir. Amma sizin istədiyiniz möcüzə olmaz, hər bir möcüzə ki Allah-Təala öz peyğəmbərinə verir, möcüzə odur, ondan başqa peyğəmbərdən istədiyiniz möcüzə* meydana gəlməz).

*(****Qeyd:*** *Bu ayəyə diqqət edilsin, yəhudilər Hz. Peyğəmbərdən möcüzə istəyirlər, Allah-Təala buyurur: "Onlara de ki, sizin istədiyiniz möcüzə olmaz, möcüzə odur ki, Allah-Təala öz peyğəmbərinə bəxş edibdir. Mən həqir isə düşünürəm ki, bəs bu nə möcüzələrdir ki, kitablarda Hz. Peyğəmbərə isnad edirlər? Halbuki o möcüzələrə diqqət edilsə, onların əksəriyyəti Hz. Peyğəmbərin şanına əskiklik gətirir. Möcüzə odur ki, Allah-Təala peyğəmbərinə versin. Amma hər bir şəxs gəlib peyğəmbərdən möcüzə tələb etsin, Qurani-Şərifə görə, o möcüzə olmaz. O möcüzələrə inanmaq Qurani-Şərifi təkzib etməkdir).*

**184) (فَإِنْ كَذَّبُوكَ)** - (ey Məhəmməd)**, əgər səni təkzib edib peyğəmbərliyini qəbul etmirlərsə, (فَقَدْ كُذِّبَ رُسُلٌ مِنْ قَبْلِكَ) - həqiqətən, səndən qabaq keçən peyğəmbərlər də təkzib olunublar. Təkzib olunan tək sən deyilsən.** (Bu ayə

جَاءُوا بِالْبَيِّنَاتِ وَالزُّبُرِ وَالْكِتَابِ الْمُنِيرِ ﴿١٨٤﴾ كُلُّ نَفْسٍ ذَائِقَةُ الْمَوْتِ وَإِنَّمَا تُوَفَّوْنَ أُجُورَكُمْ يَوْمَ
الْقِيَامَةِ فَمَنْ زُحْزِحَ عَنِ النَّارِ وَأُدْخِلَ الْجَنَّةَ فَقَدْ فَازَ وَمَا الْحَيَاةُ الدُّنْيَا إِلَّا مَتَاعُ الْغُرُورِ ﴿١٨٥﴾
لَتُبْلَوُنَّ فِي أَمْوَالِكُمْ وَأَنْفُسِكُمْ وَلَتَسْمَعُنَّ مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ وَمِنَ الَّذِينَ أَشْرَكُوا
أَذًى كَثِيرًا وَإِنْ تَصْبِرُوا وَتَتَّقُوا فَإِنَّ ذَلِكَ مِنْ عَزْمِ الْأُمُورِ ﴿١٨٦﴾

---

Hz. Peyğəmbərə təsəlli vermək üçündür). (جَاءُوا بِالْبَيِّنَاتِ وَالزُّبُرِ وَالْكِتَابِ الْمُنِيرِ)**- hansı ki o peyğəmbərlər Allah-Təala tərəfindən xalqa açıq-aşkar möcüzələrlə və müxtəsər kitablarla** (yəni səhifələrlə) **və nurani olan böyük kitablarla** (Tövrat, Zəbur və İncil və s.) gəlmişdilər, tamamən bu peyğəmbərləri təkzib ediblər. (Ey Məhəmməd), səni təkzib etdikləri üçün heç vaxt qəmgin olma).

**185) (كُلُّ نَفْسٍ ذَائِقَةُ الْمَوْتِ) -** (ey Məhəmməd)**, əgər səni təkzib edirlərsə, ondan sənə heç bir zərər aid olmaz, hər bir kəs ölümü dadacaqdır. O vaxt təkzib etməyin zərəri onlara aid olar. (وَإِنَّمَا تُوَفَّوْنَ أُجُورَكُمْ يَوْمَ الْقِيَامَةِ) -** (ey peyğəmbərləri təkzib edənlər)**, həqiqətən, peyğəmbərləri təkzib etməyin cəzası qiyamət günündə sizə veriləcəkdir. (فَمَنْ زُحْزِحَ عَنِ النَّارِ وَأُدْخِلَ الْجَنَّةَ) – kim cənnətə daxil olsa, (فَقَدْ فَازَ) - həqiqətən, o, nicat tapıbdır. Ondan başqası nicat tapan deyildir. (وَمَا الْحَيَاةُ الدُّنْيَا إِلَّا مَتَاعُ الْغُرُورِ) – dünya həyatı ancaq aldanan şəxsin zahiri xoş və batini pis olan şeyi alması kimidir.** (Necə ki bir şəxs dünyada bir mal alsa və o malın zahiri yaxşı olub, batini pis olsa, o şəxs onun zahirinə aldanıb onu alandan sonra onun eybi zahir olsa, ondan heç bir mənfəət ala bilməz, Allah-Təalanı və onun peyğəmbərini təkzib edən şəxslərin əhvalı da belədir, elə ki öldülər, o vaxt məlum olar ki, aldandıqları dünya həyatı onlara heç bir fayda verən deyildir).

**186) (لَتُبْلَوُنَّ فِي أَمْوَالِكُمْ وَأَنْفُسِكُمْ) - əlbəttə, ey möminlər, bundan sonra mallarınız tələf olub özünüz cihadda öldürülməyə düçar olacaqsınız. (وَلَتَسْمَعُنَّ مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ وَمِنَ الَّذِينَ أَشْرَكُوا أَذًى كَثِيرًا) - əlbəttə, sizdən əvvəl kitab verilən şəxslərdən** (yəhudi, xristiandan) **və müşriklərdən çox əziyyət verən sözlər eşidəcəksiniz. *(وَإِنْ تَصْبِرُوا وَتَتَّقُوا) - əgər o vaxt onların əziyyətinə səbir edib onların əziyyətinin müqabilində əziyyət etməkdən çəkinsəniz, (فَإِنَّ ذَلِكَ مِنْ عَزْمِ الْأُمُورِ) - həqiqətən, belə məqamda səbir etmək vacib olan əmrlərdəndir.**

*(***Qeyd:** O şəxslər ki islama tənə edib deyirlər: "İslamın təməli zorla, qılınc gücü ilə qoyulubdur", bir bu ayəyə baxsınlar ki, Hz. Peyğəmbərin etdiyi savaşların hamısının səbəbi məlumdur. Hz. Peyğəmbərin savaşı ya Qüreyş camaatı ilə olubdur, ya da yəhudilərlə. Amma Qüreyş camaatı özləri qoşun toplayıb, Hz. Peyğəmbərə hücum etmişdi. Yəhudilər isə nə zaman ki Hz. Peyğəmbər ilə bağlanan əhdi pozub, düşmənçilik ediblər, o vaxt da savaş olubdur. Əgər islamın təməli zorla qurulsaydı, yəhudi, xristian camaatları necə öz dinlərində qalıb, onlarla necə əhd edilib, cizyə verərdilər?*

**وَإِذْ أَخَذَ اللهُ مِيثَاقَ الَّذِينَ أُوتُوا الْكِتَابَ لَتُبَيِّنُنَّهُ لِلنَّاسِ وَلَا تَكْتُمُونَهُ فَنَبَذُوهُ وَرَاءَ ظُهُورِهِمْ وَاشْتَرَوْا بِهِ ثَمَنًا قَلِيلًا فَبِئْسَ مَا يَشْتَرُونَ ﴿١٨٧﴾ لَا تَحْسَبَنَّ الَّذِينَ يَفْرَحُونَ بِمَا أَتَوْا وَيُحِبُّونَ أَنْ يُحْمَدُوا بِمَا لَمْ يَفْعَلُوا فَلَا تَحْسَبَنَّهُمْ بِمَفَازَةٍ مِنَ الْعَذَابِ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿١٨٨﴾**

---

*Bu, islamda hürriyətin olub, məcburiliyin olmaması deyilmi? Gərək, diqqət edilsin).*

**187) ** (وَإِذْ أَخَذَ اللَّهُ مِيثَاقَ الَّذِينَ أُوتُوا الْكِتَابَ) - o zaman ki Allah-Təala o kitab** (Tövrat, İncil və Quran) **verdiyi şəxslərdən möhkəm əhd aldı,** (yəni bu kitablara agah olan şəxslərdən Allah-Təala əhd alıb onlara əmr etdi)**,** (Allah-Təalanın əhdi aləmlərə əmr etməkdən ibarətdir)**. (لَتُبَيِّنُنَّهُ لِلنَّاسِ وَلَا تَكْتُمُونَهُ) -** (o əhd budur:) **əlbəttə, siz alimlər o kitabların hökmlərini gərək gizlətməyib, o ehkamları gərək, xalqa bəyan edəsiniz. (فَنَبَذُوهُ وَرَاءَ ظُهُورِهِمْ) - amma alimlər o möhkəm olan əhdə arxa çevirib, o kitabların ehkamını xalqa dürüst bəyan etmədilər. (وَاشْتَرَوْا بِهِ ثَمَنًا قَلِيلًا) - əksinə, haqq olan hökmü bəyan etməyin əvəzində az olan dünya malını alıb, o hökmü dəyişdirdilər. (فَبِئْسَ مَا يَشْتَرُونَ) - Allah-Təalanın hökmlərinin əvəzində nə pis şey** (dünya malı) **alırlar.**

*(**Qeyd: Bu ayə buna böyük dəlildir ki, alimlər gərək haqq olan sözü xalqa bəyan etsinlər, dünyəvi məqsədlərə görə, ya da kiminsə ümid və arzusuna görə və ya "təqiyyə" edib xalqdan qorxduqları üçün haqqı gizlətməsinlər. Alim olan şəxs bu kimi məqsədləri heç düşünməyib, özünə ziyan olsa da, gərək, haqqı bəyan etsin. Bəs bizim islam alimləri bu ayəyə itaət edib Qurani-Şərifin sözlərini olduğu kimi xalqa bəyan edirlərmi? Bu mətləb bu dövrdə bəsirətli, din və ümmətin dərdini çəkən şəxslərə məxfi deyildir).*

**188) (لَا تَحْسَبَنَّ الَّذِينَ) -** (ey Məhəmməd)**, güman etmə ki, o şəxslər ki (يَفْرَحُونَ بِمَا أَتَوْا) - etdikləri əməllərinə şad olub, onu çox yaxşı əməl hesab edirlər* (وَيُحِبُّونَ أَنْ يُحْمَدُوا بِمَا لَمْ يَفْعَلُوا) - və istəyirlər ki, etmədikləri əmələ görə xalq onları tərifləsin və onlardan ötrü nicat olsun, (فَلَا تَحْسَبَنَّهُمْ بِمَفَازَةٍ مِنَ الْعَذَابِ) -** (ey Məhəmməd)**, o şəxslərin axirət əzabından nicat tapacağını güman etmə. (وَلَهُمْ عَذَابٌ أَلِيمٌ) - onlardan ötrü qiyamət günündə çox şiddətli əzab vardır.**

*(***Qeyd:** Necə ki bizim bu zəmanəmizdə olan bəzi varlı şəxsləri ki görürsən, din və ümmət yolunda heç bir xeyir əməl onlardan meydana gəlməyib, bununla belə yenə istəyirlər ki, yalandan özlərinə xeyir əməllər isnad edib, təriflənsinlər. Onlarda olmayan xüsusiyyətləri onlara isnad edib, onları din dərdi çəkən hesab edib dindar və millətpərəst bilsinlər. Halbuki din və ümmət yolunda bir dinar da sərf etməzlər. Ya da təsadüfən bir xeyir iş etsələr, o vaxt da istəyərlər ki, hər kəs qarşılarında səcdə və sitayiş edib, həmd-səna etsinlər. Belə şəxslərə nicat yoxdur).*

وَلِلّٰهِ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَاللّٰهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٨٩﴾ إِنَّ فِي خَلْقِ السَّمَاوَاتِ وَالْأَرْضِ
وَاخْتِلَافِ اللَّيْلِ وَالنَّهَارِ لَآيَاتٍ لِأُولِي الْأَلْبَابِ ﴿١٩٠﴾ الَّذِينَ يَذْكُرُونَ اللّٰهَ قِيَامًا وَقُعُودًا وَعَلَى
جُنُوبِهِمْ وَيَتَفَكَّرُونَ فِي خَلْقِ السَّمَاوَاتِ وَالْأَرْضِ رَبَّنَا مَا خَلَقْتَ هَذَا بَاطِلًا سُبْحَانَكَ فَقِنَا عَذَابَ
النَّارِ ﴿١٩١﴾ رَبَّنَا إِنَّكَ مَنْ تُدْخِلِ النَّارَ فَقَدْ أَخْزَيْتَهُ وَمَا لِلظَّالِمِينَ مِنْ أَنْصَارٍ ﴿١٩٢﴾ رَبَّنَا إِنَّنَا سَمِعْنَا
مُنَادِيًا يُنَادِي لِلْإِيمَانِ أَنْ آمِنُوا بِرَبِّكُمْ فَآمَنَّا رَبَّنَا فَاغْفِرْ لَنَا ذُنُوبَنَا وَكَفِّرْ عَنَّا سَيِّئَاتِنَا وَتَوَفَّنَا مَعَ الْأَبْرَارِ
﴿١٩٣﴾ رَبَّنَا وَآتِنَا مَا وَعَدْتَنَا عَلَى رُسُلِكَ وَلَا تُخْزِنَا يَوْمَ الْقِيَامَةِ إِنَّكَ لَا تُخْلِفُ الْمِيعَادَ ﴿١٩٤﴾

---

**189) (وَلِلّٰهِ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَاللّٰهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) - göylərin və yerin səltənəti Allah-Təala üçündür və Allah-Təala hər bir şeyə qadirdir.**

**190) (إِنَّ فِي خَلْقِ السَّمَاوَاتِ وَالْأَرْضِ وَاخْتِلَافِ اللَّيْلِ وَالنَّهَارِ لَآيَاتٍ لِأُولِي الْأَلْبَابِ) - həqiqətən, səmaların və yerin yaradılmasında, gecə və gündüzün gəlib-getməsində ağıl sahiblərindən ötrü Allah-Təalanın tövhid və qüdrətinə açıq-aşkar dəlillər vardır.**

**191) (الَّذِينَ يَذْكُرُونَ اللّٰهَ قِيَامًا وَقُعُودًا وَعَلَى جُنُوبِهِمْ وَيَتَفَكَّرُونَ فِي خَلْقِ السَّمَاوَاتِ وَالْأَرْضِ رَبَّنَا مَا خَلَقْتَ هَذَا بَاطِلًا سُبْحَانَكَ فَقِنَا عَذَابَ النَّارِ) - o şəxslər ki ayaq üstündə və oturduqları yerdə, uzandıqları yerdə Allah-Təalanı zikr edib səmaların və yerin yaradılması xüsusiyyətini təfəkkür edib, elə ki aləmlərin Xaliqinin tövhid və qüdrəti onlardan ötrü zahir oldu, o vaxt duaya başlayıb dualarında belə deyərlər: "Ey bizim rəbbimiz, hər bir eyib və nöqsandan pak və qüsursuzsan, sən bu səmaları, yeri boş və əbəs yerə yaratmamısan, bizi cəhənnəm odunun əzabından qoru".**

**192) (رَبَّنَا إِنَّكَ مَنْ تُدْخِلِ النَّارَ فَقَدْ أَخْزَيْتَهُ وَمَا لِلظَّالِمِينَ مِنْ أَنْصَارٍ) - ey bizim rəbbimiz, həqiqətən, sən kimi cəhənnəm oduna daxil etsən, həqiqətən, o şəxsi son dərəcə zəlil edərsən. Zalım olan şəxslərdən başqası cəhənnəmə daxil olmaz, zalım şəxslərə kömək edən də olmaz.**

**193) (رَبَّنَا إِنَّنَا سَمِعْنَا مُنَادِيًا يُنَادِي لِلْإِيمَانِ أَنْ آمِنُوا بِرَبِّكُمْ فَآمَنَّا رَبَّنَا فَاغْفِرْ لَنَا ذُنُوبَنَا وَكَفِّرْ عَنَّا سَيِّئَاتِنَا وَتَوَفَّنَا مَعَ الْأَبْرَارِ) - ey bizim rəbbimiz, həqiqətən, bizi imana çağıran şəxsi** (peyğəmbəri) **eşitdik. Xalqı imana çağırıb deyirdi: "Gəlin rəbbiniz Allah-Təalaya iman gətirin". Biz də ona tabe olub iman gətirdik. Bizim böyük günahlarımızı bağışlayıb, xeyir əməlimiz səbəbinə kiçik günahlarımızın üstünü ört. Bizi vəfat etdirib, ruhlarımızı yaxşı əməl sahibləriylə bir yerdə al.**

**194) (رَبَّنَا وَآتِنَا مَا وَعَدْتَنَا عَلَى رُسُلِكَ وَلَا تُخْزِنَا يَوْمَ الْقِيَامَةِ إِنَّكَ لَا تُخْلِفُ الْمِيعَادَ) - ey bizim rəbbimiz, peyğəmbərlərini təsdiq etmək müqabilində vəd etdiyin o savabı bizə ver və qiyamət günündə bizi zəlil etmə. Həqiqətən, sən vədinə xilaf çıxmayıb, hər bir vədinə vəfa edənsən.**

**فَاسْتَجَابَ لَهُمْ رَبُّهُمْ أَنِّي لَا أُضِيعُ عَمَلَ عَامِلٍ مِنْكُمْ مِنْ ذَكَرٍ أَوْ أُنْثَى بَعْضُكُمْ مِنْ بَعْضٍ فَالَّذِينَ هَاجَرُوا وَأُخْرِجُوا مِنْ دِيَارِهِمْ وَأُوذُوا فِي سَبِيلِي وَقَاتَلُوا وَقُتِلُوا لَأُكَفِّرَنَّ عَنْهُمْ سَيِّئَاتِهِمْ وَلَأُدْخِلَنَّهُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ ثَوَابًا مِنْ عِنْدِ اللَّهِ وَاللَّهُ عِنْدَهُ حُسْنُ الثَّوَابِ ﴿١٩٥﴾ لَا يَغُرَّنَّكَ تَقَلُّبُ الَّذِينَ كَفَرُوا فِي الْبِلَادِ ﴿١٩٦﴾ مَتَاعٌ قَلِيلٌ ثُمَّ مَأْوَاهُمْ جَهَنَّمُ وَبِئْسَ الْمِهَادُ ﴿١٩٧﴾**

---

**195) (فَاسْتَجَابَ لَهُمْ رَبُّهُمْ) - bu kimi dua edənlərin duasını rəbləri Allah-Təala qəbul edib onlar haqqında belə buyurur: (أَنِّي لَا أُضِيعُ عَمَلَ عَامِلٍ مِنْكُمْ) - həqiqətən, mən heç bir əməl edənin əməlini puç etmərəm. (مِنْ ذَكَرٍ أَوْ أُنْثَى) - o əməl kişidən meydana gəlsin, ya da qadından, (بَعْضُكُمْ مِنْ بَعْضٍ) - siz* kişi və qadınlar bir-birinizdənsiniz. Kişi qadından, qadın kişidəndir. İslama görə, kişi və qadınların hər ikisi insanlıqda, əməldə birdir. Kişi və ya qadın, hər kəs öz əməlinin qarşılığını görəcəkdir. (فَالَّذِينَ هَاجَرُوا وَأُخْرِجُوا مِنْ دِيَارِهِمْ) - o şəxslər** (Hz. Peyğəmbər və səhabələri) **ki hicrət edib öz vətənlərindən** (Məkkədən) **onları zorla çıxartdılar, (وَأُوذُوا فِي سَبِيلِي) – və mənim yolumda əziyyət çəkdilər, (وَقَاتَلُوا وَقُتِلُوا) – və cihad edib şəhid oldular, (لَأُكَفِّرَنَّ عَنْهُمْ سَيِّئَاتِهِمْ) - əlbəttə, o şəxslərin günahlarını örtərik. (وَلَأُدْخِلَنَّهُمْ) - əlbəttə, onları daxil edərik, (جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ) - o cənnətlərə ki onların ağaclarının və qəsrlərinin altından çaylar axır. (ثَوَابًا مِنْ عِنْدِ اللَّهِ) - bu cənnətlər Allah-Təala tərəfindən möminlərə verilən savab və əcrdir, (وَاللَّهُ عِنْدَهُ حُسْنُ الثَّوَابِ) - gözəl əcr və savab Allah-Təalanın yanındadır.**

*(*Qeyd: Kişi və qadın hər ikisi eyni dərəcədə məsul olduğu üçün onlara elm lazımdır. Qadın da kişi ilə birlikdə elmdə şərikdir. Necə ki şəriət sahibi kişi və qadını elm öyrənmədə müştərək sayıbdır, islam ümmətinin "qadınlar gərək cahil olsunlar" deməsi kişilərin cəhalətindən qaynaqlanan sözdür. Əgər kişilər elm sahibi olsalar, onlardan belə söz çıxmaz. Əvvəlcə, kişilərə elm öyrətmək lazımdır. Elə ki elm sahibi oldular, ondan sonra elmin fəzilət və şərəfini bilib qadınlara da elm öyrədəcəklər. Diqqət edilsin!)*

**196) (لَا يَغُرَّنَّكَ تَقَلُّبُ الَّذِينَ كَفَرُوا فِي الْبِلَادِ) -** (Məkkə əhlinin əksəriyyəti ticarətçi olub Şama, Yəmənə ticarətə gedərdilər. Amma Mədinə əhlinin əksəriyyəti əkinçi idi. Mədinə əhlinin kasıb, müşrik və kafir Məkkə əhlinin isə var-dövlət sahibi olması müsəlmanlara və Hz. Peyğəmbərə pis təsir edirdi. Bu ayə o barədə nazil oldu. Ayənin mənası budur:) **ey Məkkə əhlinə baxan mömin şəxslər, onların vilayətlərdə gəzib ticarət edib, varlı olmaları sizi aldatmasın.**

**197) (مَتَاعٌ قَلِيلٌ ثُمَّ مَأْوَاهُمْ جَهَنَّمُ وَبِئْسَ الْمِهَادُ) O, az olan dünya malıdır. Tezliklə fani olar, ondan sonra onların məkanları cəhənnəmdir, onlardan ötrü hazırlanan cəhənnəm nə pis yerdir.**

لَكِنِ الَّذِينَ اتَّقَوْا رَبَّهُمْ لَهُمْ جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا نُزُلًا مِنْ عِنْدِ اللَّهِ وَمَا عِنْدَ
اللَّهِ خَيْرٌ لِلْأَبْرَارِ ﴿١٩٨﴾ وَإِنَّ مِنْ أَهْلِ الْكِتَابِ لَمَنْ يُؤْمِنُ بِاللَّهِ وَمَا أُنْزِلَ إِلَيْكُمْ وَمَا أُنْزِلَ إِلَيْهِمْ خَاشِعِينَ
لِلَّهِ لَا يَشْتَرُونَ بِآيَاتِ اللَّهِ ثَمَنًا قَلِيلًا أُولَئِكَ لَهُمْ أَجْرُهُمْ عِنْدَ رَبِّهِمْ إِنَّ اللَّهَ سَرِيعُ الْحِسَابِ ﴿١٩٩﴾ يَا أَيُّهَا
الَّذِينَ آمَنُوا اصْبِرُوا وَصَابِرُوا وَرَابِطُوا وَاتَّقُوا اللَّهَ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٢٠٠﴾

---

**198) (لَكِنِ الَّذِينَ اتَّقَوْا رَبَّهُمْ) - amma o şəxslər ki öz rəbləri Allah-Təaladan qorxub, hər bir xəbis olan əməli tərk edirlər, (لَهُمْ جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ) - onlardan ötrü axirətdə ağaclarının və qəsrlərinin altından çaylar axan cənnətlər vardır. (خَالِدِينَ فِيهَا) - o cənnətlərdə həmişəlik qalarlar. (نُزُلًا مِنْ عِنْدِ اللَّهِ) - o cənnətlər onlardan ötrü Allah-Təala tərəfindən hazırlanan şeylərdir.** (Necə ki qonaqın yeyib-içməsi üçün bir şeylər hazır edərlər). **(وَمَا عِنْدَ اللَّهِ خَيْرٌ لِلْأَبْرَارِ) - Allah-Təala yanında o cənnətlərdən başqa mövcud olan şeylər xeyir əməl sahiblərindən ötrü o cənnətlərdən yaxşıdır.** (Allah-Təalanın bəndəsindən məmnunluğu və ona rəhmət nəzəri ilə yönəlməsi hər bir şeydən üstündür. Gələn ayə müsəlman olan yəhudilərdən Abdullah ibn Salam və onun yoldaşlarının haqqında nazil olubdur).

**199) (وَإِنَّ مِنْ أَهْلِ الْكِتَابِ لَمَنْ يُؤْمِنُ بِاللَّهِ وَمَا أُنْزِلَ إِلَيْكُمْ) - həqiqətən, əhli-kitabdan** (yəhudilərdən) **bəzi şəxslər vardır ki, Allah-Təalaya və sizə nazil olan Qurana iman gətirərlər. (وَمَا أُنْزِلَ إِلَيْهِمْ) - və özlərinə lazım olan kitaba da iman gətiriblər. (خَاشِعِينَ لِلَّهِ ) - qəlblərində Allah-Təaladan qorxu olduğu halda iman gətirərlər. (لَا يَشْتَرُونَ بِآيَاتِ اللَّهِ ثَمَنًا قَلِيلًا) - Allah-Təalanın ehkamını bir az dünya malına qarşılıq satıb dəyişdirməzlər. (أُولَئِكَ لَهُمْ أَجْرُهُمْ عِنْدَ رَبِّهِمْ) - o iman gətirən şəxslərin əcr, savabları öz rəbləri Allah-Təalanın yanındadır. (إِنَّ اللَّهَ سَرِيعُ الْحِسَابِ) - həqiqətən, Allah-Təala qiyamət günündə sürətlə haqq-hesab edib hər bir şəxsin əməlinin qarşılığını özünə verəndir.**

**200) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) - ey iman gətirən şəxslər, (اصْبِرُوا) – dinin ehkam təkliflərini yerinə yetirməkdə səbir edin, (وَصَابِرُوا) - cihad vaxtı düşmən qabağında nəfsinizi səbir və dözümə vadar edin ki, düşmənə qalib olasınız, (وَرَابِطُوا) - islam məmləkətinin sərhədlərində atlarınızı bağlayıb cihad etməkdən ötrü hazır olun ki, düşmən gələndə o saat cihad etməyə hazır olasınız.** (Nə vaxt müsəlmanlar bu ayələrin məzmununa baxıb əməl edəcəklər ki, hər bir kəlməsində bir aləm siyasət vardır, ar olsun müsəlmanlara!) **(وَاتَّقُوا اللَّهَ لَعَلَّكُمْ تُفْلِحُونَ) - Allah-Təaladan qorxub, Quran ehkamlarına əməl edin, əməl səbəbinə, əlbəttə, nicat tapan şəxslərdən olarsınız.**

Allaha həmd olsun, Ali-İmran surəsinin təfsiri tamamlandı. Hz. Peyğəmbər (ə.s) buyurubdur: "Kim cümə günü Ali-İmran surəsini oxusa, Allah-Təala və mələklər gün batana qədər o şəxsə rəhmət göndərərlər").

## ən-NİSA SURƏSİ

4-cü surədir. Mədinədə nazil olub, 176 ayə, 3045 kəlmə və 16030 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا
زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالًا كَثِيرًا وَنِسَاءً وَاتَّقُوا اللّٰهَ الَّذِي تَسَاءَلُونَ بِهِ وَالْأَرْحَامَ إِنَّ اللّٰهَ كَانَ عَلَيْكُمْ
رَقِيبًا ﴿١﴾ وَآتُوا الْيَتَامَى أَمْوَالَهُمْ وَلَا تَتَبَدَّلُوا الْخَبِيثَ بِالطَّيِّبِ وَلَا تَأْكُلُوا أَمْوَالَهُمْ إِلَى أَمْوَالِكُمْ
إِنَّهُ كَانَ حُوبًا كَبِيرًا ﴿٢﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمُ) - Ey insanlar, rəbbiniz Allah-Təaladan qorxub bir-birinizə zülm etməyib, qohum-əqrəbaya yaxşılıq edib, bir-birilərinizlə qardaş kimi dolanın. (الَّذِي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ) - rəbbiniz qadir olan Allah-Təaladır ki, sizi bir nəfərdən** (Hz. Adəmdən) **yaradıb, qisimlərə ayırıbdır.** (Hz. Adəm insanlığın atasıdır). **(وَخَلَقَ مِنْهَا زَوْجَهَا) - Adəmdən onun xanımı Həvvanı da yaratdı.** (Adəmin yarandığı maddədən və torpaqdan onun xanımı Həvvanı da yaratdı). **(وَبَثَّ مِنْهُمَا رِجَالًا كَثِيرًا وَنِسَاءً) - Adəmlə Həvvadan bir çox kişi və qadın törədib yaydı. (وَاتَّقُوا اللَّهَ الَّذِي تَسَاءَلُونَ بِهِ وَالْأَرْحَامَ) – o Allah-Təala ki bir-birinizdən bir şey istəyəndə qohum-əqrəba haqqını da ona qoşub bir şey istəyirsiniz, O Allah-Təaladan qorxub bir-birinizə zülm etməyin,** (ərəblərdə adət idi, bir-birilərindən bir şey istəyəndə belə deyərdilər: "Allah-Təala və qohum-əqrəba haqqı üçün səndən istəyirəm, ya da səni and verirəm Allah-Təalaya və qohum-əqrəba haqqına" . Madam ki sual edəndə qohum-əqrəba haqqını Allah-Təala ilə bir yerdə qeyd edirsiniz, əlbəttə, zülm etməyi tərk edin). **(إِنَّ اللَّهَ كَانَ عَلَيْكُمْ رَقِيبًا) - həqiqətən, Allah-Təala sizin əməllərinizə nəzarət edəndir, heç bir əməlinizdən qafil deyildir.**

**2) (وَآتُوا الْيَتَامَى أَمْوَالَهُمْ) - yetimlər həddi-büluğa və kamal səviyyəsinə yetişəndən sonra mallarını onlara verin. (وَلَا تَتَبَدَّلُوا الْخَبِيثَ بِالطَّيِّبِ) - xəbis və pis şeyi pak, yaxşı olan şeylə əvəz edib dəyişdirməyin.** (Xəbis əməl olan yetim malı yeməyi pak olan kasıbçılıqla və alış-verişlə əvəz edib dəyişdirməyin. Kasıblığı tərk edib yetim malını yeməklə məşğul olmayın). **(وَلَا تَأْكُلُوا أَمْوَالَهُمْ إِلَى أَمْوَالِكُمْ) - yetimlərin mallarını öz malınıza qarışdırıb yeməyin.** (Yetim malının səbəbinə öz malınızı da haram edirsiniz). **(إِنَّهُ كَانَ حُوبًا كَبِيرًا) - yetim malını yemək son dərəcə böyük günahdır.** (Cahiliyyə zamanında yetim qızları saxla-

وَإِنْ خِفْتُمْ أَلَّا تُقْسِطُوا فِي الْيَتَامَى فَانْكِحُوا مَا طَابَ لَكُمْ مِنَ النِّسَاءِ مَثْنَى وَثُلَاثَ وَرُبَاعَ فَإِنْ خِفْتُمْ أَلَّا تَعْدِلُوا فَوَاحِدَةً أَوْ مَا مَلَكَتْ أَيْمَانُكُمْ ذَلِكَ أَدْنَى أَلَّا تَعُولُوا ﴿٣﴾ وَآتُوا النِّسَاءَ صَدُقَاتِهِنَّ نِحْلَةً فَإِنْ طِبْنَ لَكُمْ عَنْ شَيْءٍ مِنْهُ نَفْسًا

---

yardılar, əgər mal və camal sahibi olsaydılar, malına görə ona rəğbət bəsləyib, onunla nikahlanıb malını idarə edərdilər. Çox vaxt bir şəxs 10 yetim qızla nikahlanardı. Sıradakı ayə həmin qəbih əməli tərk etmək barəsində nazil oldu).

**3) (وَإِنْ خِفْتُمْ أَلَّا تُقْسِطُوا فِي الْيَتَامَى) - yetim qızlarla evlənən zaman onların haqqında ədalətlə rəftar etməyib, onların mallarını xərcləyib, mehriyyələrini az etməkdən əgər qorxsanız, belə vaxtda o yetim qızlarla evlənməyin. (فَانْكِحُوا مَا طَابَ لَكُمْ مِنَ النِّساءِ) - o yetim qızlardan başqa, sizə halal olub pak və özünüz baxıb bəyəndiyiniz qadınlarla evlənin, (مَثْنَى وَثُلَاثَ وَرُبَاعَ)** – (onlardan) **iki, üç, dört nəfər, bu ədədlərin hansı birini seçsəniz, almaq caizdir.** (İslam ümmətinə dörddən artıq qadınla nikahlanmaq haramdır. 4 qadın da bu şərtlə caizdir ki, şəxs onların arasında ədalətlə rəftar etsin). **(فَإِنْ خِفْتُمْ أَلَّا تَعْدِلُوا) - əgər qadınların arasında ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxsanız, (فَوَاحِدَةً) - o vaxt bir nəfərlə evlənin. (أَوْ مَا مَلَكَتْ أَيْمَانُكُمْ) - ya da kəniz alıb özünüzə arvad edin, kənizi birdən çox da ala bilərsiniz, çünki kənizdə ədalət şərt deyildir.** (Məsələn, azad qadınların haqqında olan ədalət şərtlərindən biri budur ki, hər 4 gecədə bir gecə ər gərək öz xanımının yanında əlaqədə olmasa da, yatsın və hər 4 ayda bir dəfə əlaqədə olmaq vacibdir. Əgər bir kişinin 4 qadını olsa, hər 4 gecədən bir gecə, gərək, birinin yanında yatsın, iki gecə bir-birinin arxasınca bir qadının yanında yatmaq caiz deyildir. Bundan başqa da, yemək, libas, mənzil, xidmətçi şərtləri də var, amma bu şərtlərin heç biri kənizdə yoxdur. O şəxslər ki çox qadınla evlənməyi islama irad tuturlar, bəs bu ayəyə baxmırlar ki, elə ədalət şərti qoyulubdur ki, heç vaxt qadınların arasında belə ədalətlə rəftar etmək mümkün deyildir. Ərəblərdə birdən artıq arvad almaq adət idi. Birdəfəlik onlara hökm edib bu əmri onların arasından götürmək müşkül olduğuna görə, Allah-Təala hikmət üzrə ədalət şərtini qoydu ki, heç bir nəfər bu işə cəsarət etməsin. Bu şərtə baxmayaraq, bu hökmə irad tutmaq nadanlıq və ya inadkarlıqdan qaynaqlanır). **(ذَلِكَ أَدْنَى أَلَّا تَعُولُوا) - bir nəfər pak qadın almaq haqdan ayrılmayıb, qadınlara zülm etməməyiniz üçün daha uyğundur. Qadın çox olanda birinə meyil etmək o birinə zülm sayılar. Hamısına bərabər meyil və rəğbət etmək də insanın güc və imkanından xaricdir.**

**4) (وَآتُوا النِّسَاءَ صَدُقَاتِهِنَّ نِحْلَةً) – qadınların mehriyyələrini qəlbdən və könül xoşluğu ilə onlara verin, fikriniz elə olmasın ki, onların mehriyyəsindən bir qədər kəsəsiniz. (فَإِنْ طِبْنَ لَكُمْ عَنْ شَيْءٍ مِنْهُ نَفْسًا) - əgər mehriyyələrindən hər**

فَكُلُوهُ هَنِيئًا مَرِيئًا ﴿٤﴾ وَلَا تُؤْتُوا السُّفَهَاءَ أَمْوَالَكُمُ الَّتِي جَعَلَ اللَّهُ لَكُمْ قِيَامًا وَارْزُقُوهُمْ فِيهَا وَاكْسُوهُمْ وَقُولُوا لَهُمْ قَوْلًا مَعْرُوفًا ﴿٥﴾ وَابْتَلُوا الْيَتَامَى حَتَّى إِذَا بَلَغُوا النِّكَاحَ فَإِنْ آنَسْتُمْ مِنْهُمْ رُشْدًا فَادْفَعُوا إِلَيْهِمْ أَمْوَالَهُمْ وَلَا تَأْكُلُوهَا إِسْرَافًا وَبِدَارًا أَنْ يَكْبَرُوا وَمَنْ كَانَ غَنِيًّا فَلْيَسْتَعْفِفْ وَمَنْ كَانَ فَقِيرًا فَلْيَأْكُلْ بِالْمَعْرُوفِ

---

**hansı bir şeyi öz istəkləri ilə qəlbdən sizə bağışlasalar, (فَكُلُوهُ هَنِيئًا مَرِيئًا) – nə vaxt ki mehriyyələrindən sizə bir şey bağışlasalar, o zaman nuşcanlıqla yeyin.** (Qadınlarını boşamaq istəyən kişilər bu ayəyə baxıb, Allah-Təaladan qorxub onlara zülm və əziyyət etməsinlər ki, qadınlar da zülm səbəbinə mehriyyələrindən əl çəkib boşanmağa razı olsunlar. Sıradakı ayə o şəxslər haqqında nazil olubdur ki, mallarını idarə etməyə və ya ticarətin qayda-qanununa agah deyillər, ya da haram yolda mallarını sərf edərlər. Belə şəxslərə islam şəriətində səfeh deyilir. Öz mallarını idarə etməyə ixtiyarları yoxdur, gərək, onlardan ötrü qəyyum təyin olunsun. Necə ki ayədə qəyyumlara xitab edib buyurur:)

**5) (وَلَا تُؤْتُوا السُّفَهَاءَ أَمْوَالَكُمُ)** – (ey səfeh şəxslərin qəyyumları)**, o mallar ki sizin əlinizdə vardır, ona qəyyumsunuz, o malları səfeh sahiblərinə verməyin. (الَّتِي جَعَلَ اللَّهُ لَكُمْ قِيَامًا) - hansı ki sizin o mallara qəyyum olub idarə etməyinizi Allah-Təala təyin edibdir. (وَارْزُقُوهُمْ فِيهَا وَاكْسُوهُمْ) - səfehlərə öz mallarının mənfəətindən lazım olan qədər xərclik və libas verin,** (yəni onların malları ilə ticarət edib onun mənfəətindən onlara xərclik və libas verin). **(وَقُولُوا لَهُمْ قَوْلًا مَعْرُوفًا) - səfeh şəxslər əgər sizə desələr ki, bizim mallarımızı verin, o vaxt da onlara gözəl şəkildə cavab verin. Onları sakit edin.** (Məsələn, deyin ki, nə vaxt yaxşı mənfəət olsa, sən israf etməsən və malın artıq olsa, o vaxt da sənə təslim edərəm).

**6) (وَابْتَلُوا الْيَتَامَى) - yetimlərin ağıllarını yoxlayıb, baxıb görün mallarını idarə etməyə ağılları var? (حَتَّى إِذَا بَلَغُوا النِّكَاحَ) – nə zaman ki həddi- buluğa çatdılar, (فَإِنْ آنَسْتُمْ مِنْهُمْ رُشْدًا) - əgər yetimlərin öz mallarını gözəl şəkildə idarə etmələri və ticarət yollarına agah olmaları sizə aydın olsa, o zaman (فَادْفَعُوا إِلَيْهِمْ أَمْوَالَهُمْ) - onlara öz mallarını verin. (وَلَا تَأْكُلُوهَا إِسْرَافًا وَبِدَارًا أَنْ يَكْبَرُوا) – böyüyüb mallarını sizdən alacaqlar qorxusu ilə yetimlərin mallarını nahaq şəkildə yeməyə çalışmayın. (وَمَنْ كَانَ غَنِيًّا فَلْيَسْتَعْفِفْ) - hansı qəyyum əgər varlı olsa, özünü saxlayıb yetimin malını yeməkdən çəkinsin. (وَمَنْ كَانَ فَقِيرًا فَلْيَأْكُلْ بِالْمَعْرُوفِ) - hansı qəyyum da kasıb olsa, yetimin malından lazım olan qədər yeməsinə, içməsinə, libasdan istifadə etməsinə ona izin vardır.** (Amma bu şərtlə ki, əgər o malın zəhmətini çəkib alış-veriş edib ondan mənfəət hasil etsə, o vaxt o malın mənfəətindən lazım olan qədər özünə sərf edə bilər. Amma əgər o mal üçün heç bir zəhmət çəkməsə, bir dinar da özü

فَإِذَا دَفَعْتُمْ إِلَيْهِمْ أَمْوَالَهُمْ فَأَشْهِدُوا عَلَيْهِمْ وَكَفَى بِاللَّهِ حَسِيبًا ﴿٦﴾ لِلرِّجَالِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ
وَالْأَقْرَبُونَ وَلِلنِّسَاءِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ مِمَّا قَلَّ مِنْهُ أَوْ كَثُرَ نَصِيبًا مَفْرُوضًا ﴿٧﴾
وَإِذَا حَضَرَ الْقِسْمَةَ أُولُو الْقُرْبَى وَالْيَتَامَى وَالْمَسَاكِينُ فَارْزُقُوهُمْ مِنْهُ وَقُولُوا لَهُمْ قَوْلًا مَعْرُوفًا ﴿٨﴾
وَلْيَخْشَ الَّذِينَ لَوْ تَرَكُوا مِنْ خَلْفِهِمْ ذُرِّيَّةً ضِعَافًا خَافُوا عَلَيْهِمْ فَلْيَتَّقُوا اللَّهَ وَلْيَقُولُوا قَوْلًا سَدِيدًا ﴿٩﴾

---

üçün sərf edə bilməz). **(فَإِذَا دَفَعْتُمْ إِلَيْهِمْ أَمْوَالَهُمْ) - yetimlərə ağıllı və kamil olandan sonra mallarını verdiyiniz zaman, (فَأَشْهِدُوا عَلَيْهِمْ) - onlara şahid tutub şahid hüzurunda verin** (ki, yenidən mallarını sizdən tələb etməsinlər). **(وَكَفَى بِاللَّهِ حَسِيبًا) - haqq-hesab çəkməkdə təkcə Allah-Təala kifayət edər.** (Çünki haqq-hesab çəkən Allah-Təaladır, Allah-Təaladan qorxub yetimlərin malına xəyanət etməyin ki, onun haqq-hesabını Allah-Təala sizdən çəkəcəkdir. Bundan sonra gələn ayələrdə miras ehkamını bəyan edir. Cahiliyyə zamanında ərəblərdə adət idi, qadınlara miras verməzdilər. Sıradakı ayədə Allah-Təala həm kişilər, həm də qadınlar üçün mirası əmr edir).

**7) (لِلرِّجَالِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ) - kişilərdən ötrü ata-ananın, qohum-əqrəbaların** (hansı ki onlardan miras alınır) **qoyub getdiyi şeylərdən bir hissə və pay vardır, (وَلِلنِّسَاءِ نَصِيبٌ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ) - qadınlardan ötrü də ata-ananın və sair qohum-əqrəbaların** (hansı ki onlardan miras alınır) **qoyub getdiyi şeylərdən bir hissə və pay vardır, elə deyil ki, qadınlar üçün miras olmasın. (مِمَّا قَلَّ مِنْهُ أَوْ كَثُرَ) - kişi və qadın az və ya çox nə ki pay alırlar, (نَصِيبًا مَفْرُوضًا) - bu pay və hissə onlardan ötrü vacibdir. Əlbəttə, gərək onlara çatsın.**

**8) (وَإِذَا حَضَرَ الْقِسْمَةَ أُولُو الْقُرْبَى وَالْيَتَامَى وَالْمَسَاكِينُ فَارْزُقُوهُمْ مِنْهُ وَقُولُوا لَهُمْ قَوْلًا مَعْرُوفًا) - ölünün malını varislərin arasında bölən zaman varis olmayan qohum-əqrəbalar, yetim və yoxsullar da orada olsalar, o ölünün malından onlara da bir qədər pay verib, gözəl sözlər deyib onlardan üzr istəyin.** (Belə deyin: "Hərçənd bu şey azdır, sizə layiq deyil, bağışlayın", bu kimi sözlərdən deyib onlardan üzrxahlıq edin). Bu ayə buna işarə edir ki, miras vaxtı orada olsalar, ölənin malından qeyd olunan şəxslər üçün də bir pay vardır).

**9) (وَلْيَخْشَ الَّذِينَ لَوْ تَرَكُوا مِنْ خَلْفِهِمْ ذُرِّيَّةً ضِعَافًا خَافُوا عَلَيْهِمْ فَلْيَتَّقُوا اللَّهَ وَلْيَقُولُوا قَوْلًا سَدِيدًا) – qohumlar və qəyyumlar yetimlərin haqqında Allah-Təaladan qorxub, onlara zülm etməyib onların mallarını tələf etməsinlər. Əgər özləri ölüb özlərindən sonra kiçik və zəif övlad qoyub getsələr, onlar üçün zülm və əziyyət olmasın, deyə nə qədər qorxarlarsa, özlərindən sonra o yetimlər üçün də gərək qorxsunlar, əlbəttə, qəyyumlar gərək Allah-Təaladan qorxub yetimlərlə haqq və ədalətlə danışsınlar, necə ki öz övladları ilə danışırlar.**

إِنَّ الَّذِينَ يَأْكُلُونَ أَمْوَالَ الْيَتَامَى ظُلْمًا إِنَّمَا يَأْكُلُونَ فِي بُطُونِهِمْ نَارًا وَسَيَصْلَوْنَ سَعِيرًا ﴿١٠﴾
يُوصِيكُمُ اللَّهُ فِي أَوْلَادِكُمْ لِلذَّكَرِ مِثْلُ حَظِّ الْأُنْثَيَيْنِ فَإِنْ كُنَّ نِسَاءً فَوْقَ اثْنَتَيْنِ فَلَهُنَّ ثُلُثَا مَا تَرَكَ وَإِنْ
كَانَتْ وَاحِدَةً فَلَهَا النِّصْفُ وَلِأَبَوَيْهِ لِكُلِّ وَاحِدٍ مِنْهُمَا السُّدُسُ مِمَّا تَرَكَ إِنْ كَانَ لَهُ وَلَدٌ فَإِنْ لَمْ يَكُنْ
لَهُ وَلَدٌ وَوَرِثَهُ أَبَوَاهُ فَلِأُمِّهِ الثُّلُثُ فَإِنْ كَانَ لَهُ إِخْوَةٌ

---

**10) (إِنَّ الَّذِينَ يَأْكُلُونَ أَمْوَالَ الْيَتَامَى ظُلْمًا إِنَّمَا يَأْكُلُونَ فِي بُطُونِهِمْ نَارًا وَسَيَصْلَوْنَ سَعِيرًا) - həqiqətən, yetimlərin mallarını zülm yoluyla yeyən şəxslər, əslində, öz qarınlarına od yeyirlər.** (Həmin yedikləri oda çevriləcəkdir)**. Əlbəttə, onlar qiyamət günündə əzab edilmək üçün cəhənnəm odlarından bir yanar oda vasil olacaqlar.** (Əvvəlki ayələrdə miras ehkamını müxtəsər şəkildə əmr edib, kişi, qadın və sair qohum-əqrəba, yetim və yoxsullardan ötrü haqqı sabit etdi. Bundan sonra sıradakı ayələrdə də miras ehkamını təfsilatı ilə bəyan edib hər şəxsin payını təyin edir).

**11) (يُوصِيكُمُ اللَّهُ فِي أَوْلَادِكُمْ) - Allah-Təala sizə övladlarınızın haqqında miras vəsiyyət edib buyurur: "Əgər bir şəxs ölsə, kişi və qadın bərabər mirasa sahib olsalar, (لِلذَّكَرِ مِثْلُ حَظِّ الْأُنْثَيَيْنِ) - kişi üçün mirasda iki qadının payı qədər vardır. İki hissə kişiyə, bir hissə qadına düşər.** (Kişi və qadın birlikdə mirasa sahib olanda bu ayə o vaxt qüvvədə olar, amma əgər ölünün ata-anası, ya da xanımı olmasa, bir oğul övladı olsa, malın hamısı onundur, əgər valideyni, ya da xanımı da olsa, hər kəs öz payını alar, necə ki bundan sonra qeyd olunur). **(فَإِنْ كُنَّ نِسَاءً) - əgər ölünün övladı qız olub, oğul övladı olmasa, (فَوْقَ اثْنَتَيْنِ) – və o qadınlar iki nəfər, ya iki nəfərdən artıq olsalar, (فَلَهُنَّ ثُلُثَا مَا تَرَكَ) - onlardan ötrü o ölünün malından üçdə iki pay vardır,** (mal 3 yerə bölünür, iki hissəsi qızların payıdır). **(وَإِنْ كَانَتْ وَاحِدَةً فَلَهَا النِّصْفُ) - əgər o ölünün övladı bir nəfər qız olsa, ona ölünün malının yarısı* verilər.**

*(***Qeyd:** Qızların hissəsindən artıq qalan mal bu ayələrə görə beytül-mala təslim olunub Allah yolunda müsəlmanların xeyri üçün gərək sərf olunsun. Amma rəvayətlərə əsaslanan üləmalar o hissədən artıq qalan malı da həmin varislərə vermək haqqında fitva veriblər).*

**(وَلِأَبَوَيْهِ) - ölünün ata-anasından ötrü onun malından, (لِكُلِّ وَاحِدٍ مِنْهُمَا السُّدُسُ مِمَّا تَرَكَ) - hər birindən ötrü ölünün qoyub getdiyinin altıda bir hissəsi qədər pay vardır.** (Mal 6 yerə bölünər, əgər hər ikisi də sağ olsalar, 6-da bir hissə ataya və bir hissə də anaya verilir, əgər ikisi də sağ olmasa, hansı ki sağdır, o, öz payını alar). **(إِنْ كَانَ لَهُ وَلَدٌ) - ölünün övladı olarsa, ata və ananın hər birinə 6-da bir hissə verilər. (فَإِنْ لَمْ يَكُنْ لَهُ وَلَدٌ) - əgər ölünün övladı olmasa, (وَوَرِثَهُ أَبَوَاهُ) - ata-anasının ona varis olması iki qisimdir. Bir qismi odur ki, ölünün qardaşları olmasın, o vaxt, (فَلِأُمِّهِ الثُّلُثُ) - onun anasından ötrü malın 3-də bir hissəsi vardır, iki hissəsi atanındır,** (ikinci qismi belədir:) **(فَإِنْ كَانَ لَهُ إِخْوَةٌ)**

فَلِأُمِّهِ السُّدُسُ مِنْ بَعْدِ وَصِيَّةٍ يُوصِي بِهَا أَوْ دَيْنٍ آبَاؤُكُمْ وَأَبْنَاؤُكُمْ لَا تَدْرُونَ أَيُّهُمْ أَقْرَبُ لَكُمْ نَفْعًا
فَرِيضَةً مِنَ اللهِ إِنَّ اللهَ كَانَ عَلِيمًا حَكِيمًا ﴿١١﴾ وَلَكُمْ نِصْفُ مَا تَرَكَ أَزْوَاجُكُمْ إِنْ لَمْ يَكُنْ لَهُنَّ
وَلَدٌ فَإِنْ كَانَ لَهُنَّ وَلَدٌ فَلَكُمُ الرُّبُعُ مِمَّا تَرَكْنَ مِنْ بَعْدِ وَصِيَّةٍ يُوصِينَ بِهَا أَوْ دَيْنٍ وَلَهُنَّ الرُّبُعُ مِمَّا
تَرَكْتُمْ إِنْ لَمْ يَكُنْ لَكُمْ وَلَدٌ

---

**- əgər o ölünün qardaşları olsa, o vaxt da, (فَلِأُمِّهِ السُّدُسُ) - onun anasından ötrü 6-da bir hissə vardır, qalan mal atanındır.** (Hərçənd ata-ana sağ olanda qardaşlar qardaşın malından pay ala bilməz. Amma ananın 3-də bir pay almasına mane olarlar. Onlar varsa, ana 6-da bir pay alar, əgər qardaşlar olmasa, ana 3-də bir hissə alar). **(مِنْ بَعْدِ وَصِيَّةٍ يُوصِي بِهَا أَوْ دَيْنٍ) - o hissələr ki, ölünün malından qeyd olundu, hamısı vəsiyyət və borcdan sonradır.** (Əgər şəxs vəsiyyət edibsə, ya da borcu varsa, əvvəlcə onlar maldan ödənir. Ondan sonra qalan mal varislərin arasında bölünər). **(آبَاؤُكُمْ وَأَبْنَاؤُكُمْ) - sizin atalarınız və oğullarınız hansı ki ölüm onları ziyarət edir, bəzisi vəsiyyət edər, bəzisi etməz, amma siz istəyirsiniz ki, vəsiyyət olmasın. (لَا تَدْرُونَ أَيُّهُمْ أَقْرَبُ لَكُمْ نَفْعًا) - amma siz agah deyilsiniz ki, xeyir və mənfəətdə onların hansı sizə yaxın və sizdən ötrü yaxşıdır.** (İstəyirsiniz ki, vəsiyyət olmasın, amma vəsiyyətin sizə mənfəəti daha çoxdur. Vəsiyyətdə həm dünya, həm də axirət mənfəəti vardır. Vəsiyyət əgər Allah-Təala yolunda ümmətin övladlarının xeyri, din və məzhəb tərəqqisi üçün olsa, necə ki vəsiyyət edibdir, əgər o cür rəftar edib, o malı millətin cəhalət və zəlalətdən xilas olmağı üçün sərf etsəniz, o vaxt siz Allah-Təala yanında və məxluqat nəzərində nə qədər böyük mərtəbə və məqam sahibi olarsınız. Varlı şəxsləri ölmədən əvvəl millətin xeyir və mənfəəti üçün vəsiyyət etməyə vadar etmək lazımdır). **(فَرِيضَةً مِنَ اللهِ) - qabaqda qeyd olunan hökmlərin hamısı Allah-Təala tərəfindən sizə vacib olubdur. Gərək onlara əməl edəsiniz. (إِنَّ اللهَ كَانَ عَلِيمًا حَكِيمًا) - həqiqətən, Allah-Təala insanların xeyrindən agahdır və onların arasında ölünün malını hikmət üzrə bölər.** (Növbəti ayədə Allah-Təala ər və arvadın miras ehkamını və bəzi başqa miras ehkamlarını bəyan edir).

**12) (وَلَكُمْ نِصْفُ مَا تَرَكَ أَزْوَاجُكُمْ) - siz kişilərdən ötrü qadınlarınızın qoyub getdiyi malın yarısı var. (إِنْ لَمْ يَكُنْ لَهُنَّ وَلَدٌ) - əgər qadınların övladı olmasa,** (ya bu ərindən, ya da digər ərindən uşağı olmasa, ya da uşağı sağ qalmasa,) **onun malının yarısı ərinindir. (فَإِنْ كَانَ لَهُنَّ وَلَدٌ) - əgər qadınların övladı olsa, (فَلَكُمُ الرُّبُعُ مِمَّا تَرَكْنَ) - siz kişilərdən ötrü qadınların qoyub getdiyi maldan 4-də bir hissə vardır. (مِنْ بَعْدِ وَصِيَّةٍ يُوصِينَ بِهَا أَوْ دَيْنٍ) - siz kişilərin qadınların malından miras alması vəsiyyət və borcdan sonradır. Əgər qadınların vəsiyyəti, ya da borcu olmuş olsa, əvvəl onlar ödənər. Ondan sonra miras alınar. (وَلَهُنَّ الرُّبُعُ مِمَّا تَرَكْتُمْ) - qadınlardan ötrü ölən kişilərin qoyub getdiyi maldan 4-də bir hissə vardır. (إِنْ لَمْ يَكُنْ لَكُمْ وَلَدٌ) - əgər siz kişilərin övladı**

فَإِنْ كَانَ لَكُمْ وَلَدٌ فَلَهُنَّ الثُّمُنُ مِمَّا تَرَكْتُمْ مِنْ بَعْدِ وَصِيَّةٍ تُوصُونَ بِهَا أَوْ دَيْنٍ وَإِنْ كَانَ رَجُلٌ يُورَثُ كَلَالَةً
أَوِ امْرَأَةٌ وَلَهُ أَخٌ أَوْ أُخْتٌ فَلِكُلِّ وَاحِدٍ مِنْهُمَا السُّدُسُ فَإِنْ كَانُوا أَكْثَرَ مِنْ ذَلِكَ فَهُمْ شُرَكَاءُ فِي الثُّلُثِ
مِنْ بَعْدِ وَصِيَّةٍ يُوصَى بِهَا أَوْ دَيْنٍ غَيْرَ مُضَارٍّ وَصِيَّةً مِنَ اللَّهِ وَاللَّهُ عَلِيمٌ حَلِيمٌ ﴿١٢﴾ تِلْكَ حُدُودُ اللَّهِ
وَمَنْ يُطِعِ اللَّهَ وَرَسُولَهُ يُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا وَذَلِكَ الْفَوْزُ الْعَظِيمُ ﴿١٣﴾

---

**olmasa, (فَإِنْ كَانَ لَكُمْ وَلَدٌ) əgər sizin övladınız varsa (فَلَهُنَّ الثُّمُنُ مِمَّا تَرَكْتُمْ) - sizin qoyub getdiyiniz maldan qadınlar üçün 8-də bir hissə vardır. (مِنْ بَعْدِ وَصِيَّةٍ تُوصُونَ بِهَا أَوْ دَيْنٍ) – qadınların siz kişilərdən miras alması vəsiyyət və borcdan sonradır. (وَإِنْ كَانَ رَجُلٌ يُورَثُ كَلَالَةً أَوِ امْرَأَةٌ) - əgər miras alınan ölü kişi və ya qadının varislərinin analarının övladı olsa, (وَلَهُ أَخٌ أَوْ أُخْتٌ) - o ölünün eyni anadan bir qardaşı və ya bir bacısı olsa, (فَلِكُلِّ وَاحِدٍ مِنْهُمَا السُّدُسُ) - o qardaş və ya o bacıdan ötrü onun malından 6-da bir hissə vardır. (فَإِنْ كَانُوا أَكْثَرَ مِنْ ذَلِكَ) - əgər eyni ananın övladı iki nəfər, ya da iki nəfərdən artıq olsa, onlardan ötrü ölünün malından 3-də bir hissə vardır. (فَهُمْ شُرَكَاءُ فِي الثُّلُثِ) - hamısı o malın 3-də birinə şərikdirlər.** (Bərabər bölərlər, kişi olsunlar, ya da qadın, ya da bəzisi kişi, bəzisi qadın, fərqi yoxdur. Əgər eyni ananın övladı bir nəfər olsa, ona 6-da bir hissə verilər, əgər bir nəfərdən artıq olsalar, 3-də bir hissə çatar, kişi və qadın bərabər bölərlər. Qalan mal ata və anaları eyni olan qardaş və bacılara çatar. Sadəcə atabir qardaş və bacı olana bir şey çatmaz. Əgər ata, ana, qardaş və bacı olmasa, eyni ananın övladı öz hissəsini alandan sonra qalan mal sadəcə atabir olan qardaş və bacıya çatar. Son söz budur ki, təkcə atabir olan qardaş, bacı eyni ata və anadan olan qardaş və bacı olanda miras almaz. Amma eyni ananın övladı hər iki halda da miras alar. Əgər eyni ana övladından başqa qardaş və bacı olmasa, qalan mal, gərək, beytülmala verilsin. Amma üləmanın fitvasına görə, o mal da həmin eyni ana övladına verilər. (مِنْ بَعْدِ وَصِيَّةٍ يُوصَى بِهَا أَوْ دَيْنٍ غَيْرَ مُضَارٍّ) **- bu miras almaq vəsiyyət və borcdan sonradır. Amma vəsiyyət edən, gərək, elə vəsiyyət etsin ki, varislərə ziyan olmasın.** (Gərək, 6-da birdən artıq vəsiyyət etməsin). **Şəxsin öz malının 6-da birdən artığını vəsiyyət etməyə ixtiyarı yoxdur, əgər 6-da birdən artıq vəsiyyət etsə, 3-də biri səhihdir. Ondan artığı varislərin imzası ilə etibarlıdır, varislər imza etsələr, səhihdir, yoxsa batildir. (وَصِيَّةً مِنَ اللَّهِ وَاللَّهُ عَلِيمٌ حَلِيمٌ) - bu hökmlər Allah-Təaladan sizlərə vəsiyyət və əmrdir. Allah-Təala vəsiyyətində zülm edən və ya adil olan şəxsdən agahdır və O əzab etməkdə tələsən deyildir.**

**13) (تِلْكَ حُدُودُ اللَّهِ وَمَنْ يُطِعِ اللَّهَ وَرَسُولَهُ يُدْخِلْهُ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا وَذَلِكَ الْفَوْزُ الْعَظِيمُ) - bu qeyd olunan hökmlər Allah-Təalanın hədləri və qanunlarıdır ki, miras haqqında qeyd olundu. Kim Allah-Təalaya və peyğəmbərinə itaət edib, bu ehkama əməl etsə, Allah-Təala onu ağacları-**

وَمَنْ يَعْصِ اللَّهَ وَرَسُولَهُ وَيَتَعَدَّ حُدُودَهُ يُدْخِلْهُ نَارًا خَالِدًا فِيهَا وَلَهُ عَذَابٌ مُهِينٌ ﴿١٤﴾ وَاللَّاتِي
يَأْتِينَ الْفَاحِشَةَ مِنْ نِسَائِكُمْ فَاسْتَشْهِدُوا عَلَيْهِنَّ أَرْبَعَةً مِنْكُمْ فَإِنْ شَهِدُوا فَأَمْسِكُوهُنَّ فِي الْبُيُوتِ
حَتَّى يَتَوَفَّاهُنَّ الْمَوْتُ أَوْ يَجْعَلَ اللَّهُ لَهُنَّ سَبِيلًا ﴿١٥﴾ وَاللَّذَانِ يَأْتِيَانِهَا مِنْكُمْ فَآذُوهُمَا فَإِنْ تَابَا
وَأَصْلَحَا فَأَعْرِضُوا عَنْهُمَا

---

**nın və qəsrlərinin altından çaylar axan cənnətlərə daxil edər. Həmişəlik orada qalıb oradan çıxmazlar. Böyük əcr və savaba çatmaq budur.**

**14) (وَمَنْ يَعْصِ اللَّهَ وَرَسُولَهُ وَيَتَعَدَّ حُدُودَهُ يُدْخِلْهُ نَارًا خَالِدًا فِيهَا وَلَهُ عَذَابٌ مُهِينٌ) - kim Allah-Təalaya və Onun peyğəmbərinə asi olub, Allah-Təalanın qoyduğu hədləri aşıb onlara əməl etməsə, Allah-Təala onu cəhənnəm oduna daxil edər, həmişəlik orada qalacaqdır. O şəxsdən ötrü həqir və zəlil edən əzab vardır.**

**15) (وَاللَّاتِي يَأْتِينَ الْفَاحِشَةَ مِنْ نِسَائِكُمْ) - qadınlarınızdan zina edənlərin, (فَاسْتَشْهِدُوا عَلَيْهِنَّ أَرْبَعَةً مِنْكُمْ) - zina etməsinə dair içinizdən 4 nəfər kişi şahid gətirin. (Şahid gərək 4 nəfər kişi olsun, əgər zina edən evli olsa, (o zaman, gərək, daşlansın), 3 kişi, iki qadın da kifayət edər. Fəqihlər belə fitva veriblər. Amma ayənin zina barəsində 4 nəfər kişi şahidi şərt qoşması zahir və aşkardır. (فَإِنْ شَهِدُوا) - əgər 4 nəfər şahid qadının zina etməsinə şahidlik etsələr, (فَأَمْسِكُوهُنَّ فِي الْبُيُوتِ) - o vaxt onları evlərdə həbs edin, (حَتَّى يَتَوَفَّاهُنَّ الْمَوْتُ) – ta ki ölüm gəlib, ömürləri tamam olana qədər** (onları həbs edin). **(أَوْ يَجْعَلَ اللَّهُ لَهُنَّ سَبِيلًا) – ya da Allah-Təala onlara bir yol açana qədər ki, tövbə edib şəriət nikahı ilə ərə getsinlər.** (Bu ayə zina edən qadınlar haqqında nazil olubdur, amma kişinin hökmü bu ayədə zikr olunmayıbdır. Bu hökm islamın ilk dövrlərində var idi. Bir neçə müddətdən sonra bu əmr hökmsüz oldu, onun yerinə qamçı cəzası verildi. Necə ki bundan sonra gələn Nur surəsində bəyan edilir ki, zinakar qadın və kişinin hər birinə gərək 100 qamçı vurulsun. İnşallah Nur surəsinin təfsirində qeyd olunacaq. Sıradakı ayə homoseksuallar haqqındadır).

**16) (وَاللَّذَانِ يَأْتِيَانِهَا مِنْكُمْ) – siz kişilərdən iki nəfər pis olan homoseksuallıq əməlinə qoşulsa, (فَآذُوهُمَا) – bu, sübut ediləndən sonra onlara əziyyət və əzab edin.** (Homoseksuallığın sübutu da zina kimi 4 nəfər şahidlə olar. Homoseksuallıq son dərəcə çirkin əməl olduğuna görə, Allah-Təala ondan ötrü müəyyən hədd cəzası verməyib, Hz. Peyğəmbərin rəyinə həvalə edibdir. Amma zinadan ötrü müəyyən hədd cəzası təyin edib. Hz. Peyğəmbər ağıllı və həddi-büluğa çatan homoseksualların qətlinə hökm veribdir (Tirmizi, Hudud, 24; Əbu Davud, Hudud 29; Tusi, Təhzib, X/54), amma əgər dəli, ya da həddi-büluğa çatmamış olsalar, şəriət hakimi, gərək, onları tənbeh etsin). **(فَإِنْ تَابَا وَأَصْلَحَا) - əgər homoseksuallıq sübut olunmadan əvvəl tövbə edib saleh əməl etsələr, (فَأَعْرِضُوا عَنْهُمَا) - siz də onlardan üz döndərib daha onlara əziyyət və əzab**

إِنَّ اللَّهَ كَانَ تَوَّابًا رَحِيمًا ﴿١٦﴾ إِنَّمَا التَّوْبَةُ عَلَى اللهِ لِلَّذِينَ يَعْمَلُونَ السُّوءَ بِجَهَالَةٍ ثُمَّ يَتُوبُونَ مِنْ قَرِيبٍ فَأُولَئِكَ يَتُوبُ اللَّهُ عَلَيْهِمْ وَكَانَ اللَّهُ عَلِيمًا حَكِيمًا ﴿١٧﴾ وَلَيْسَتِ التَّوْبَةُ لِلَّذِينَ يَعْمَلُونَ السَّيِّئَاتِ حَتَّى إِذَا حَضَرَ أَحَدَهُمُ الْمَوْتُ قَالَ إِنِّي تُبْتُ الْآنَ وَلَا الَّذِينَ يَمُوتُونَ وَهُمْ كُفَّارٌ أُولَئِكَ أَعْتَدْنَا لَهُمْ عَذَابًا أَلِيمًا ﴿١٨﴾

---

**etməyin.** (Amma əgər homoseksuallıqları sübut ediləndən sonra tövbə etsələr, o vaxt əzab onlardan götürülməz. Onlardan ötrü qətl hökmü sabitdir). **(إِنَّ اللَّهَ كَانَ تَوَّابًا رَحِيمًا) - həqiqətən, Allah-Təala tövbəni qəbul edib məxluqata rəhm edəndir.** (Bu ayədə homoseksuallardan ötrü tövbəni bəyan etdi. Sıradakı ayədə bəyan edir ki, nə zaman hansı günahkar şəxsin tövbəsi qəbul olunar).

**17) (إِنَّمَا التَّوْبَةُ عَلَى اللهِ) - həqiqətən, tövbəni qəbul etmək Allah-Təalaya lazımdır, (لِلَّذِينَ يَعْمَلُونَ السُّوءَ بِجَهَالَةٍ) - o şəxslərdən ötrü ki, o günahın çirkin olmasını bilmədikləri halda o günahı edərlər, (ثُمَّ يَتُوبُونَ مِنْ قَرِيبٍ) - və ondan sonra günah etməyə az qalmış tövbə edərlər, günahdan sonra elə ki günahın çirkinliyinə agah oldular, tezliklə peşman olub tövbə edərlər, daha tövbəni təxirə salmazlar. (فَأُولَئِكَ يَتُوبُ اللَّهُ عَلَيْهِمْ ) - bu tövbə edənlərin tövbələrini Allah-Təala qəbul edər, nəinki hər bir tövbə edənin. (وَكَانَ اللَّهُ عَلِيمًا حَكِيمًا) - Allah-Təala bəndələrinin əhvalından agahdır ki, hansı şəxs günahı bilmədən edib, ta ki onun tövbəsini qəbul etsin, Allah-Təala nə əməl etsə, onu hikmət üzrə edər.**

**18) (وَلَيْسَتِ التَّوْبَةُ) - Allah-Təalaya tövbəni qəbul etmək lazım deyil, (لِلَّذِينَ يَعْمَلُونَ السَّيِّئَاتِ) - o şəxslərdən ötrü ki, günahı edəndən sonra tövbəni təxirə salarlar, (حَتَّى إِذَا حَضَرَ أَحَدَهُمُ الْمَوْتُ) – və o günahkarlardan birinə ölüm gəlib, aşkar olanda ki, indi öləcək, ta o zamana qədər tövbə etməzlər, (قَالَ إِنِّي تُبْتُ الْآنَ) - o vaxt ki ölümü aşkar görər, deyər: "İndi mən öz günahlarımdan tövbə etdim".** (Belə şəxsin tövbəsi qəbul deyildir). **(وَلَا الَّذِينَ يَمُوتُونَ وَهُمْ كُفَّارٌ) - Və bir də axirətdə o şəxslərin tövbəsi qəbul olunmaz ki, ölüm onlara gəlib, küfr halətlərində dünyadan gedərlər. Bunlar axirətdə tövbə etsələr də, tövbələri qəbul edilən deyildir,** (çünki axirət təklif aləmi deyil). **(أُولَئِكَ) - bu tövbəni təxirə salanlar və kafir olanlar üçün, (أَعْتَدْنَا لَهُمْ عَذَابًا أَلِيمًا) - artıq şiddətli əzabı onlardan ötrü hazır etmişik.** (Sıradakı ayə iki hökm barəsində nazil olubdur. 1-ci hökm odur ki, cahiliyyə zamanında əgər bir şəxs ölüb onun gözəl bir arvadı qalsaydı, o şəxsin qohum-əqrəbasından biri – ya qardaşı, ya əmisi, ya əmisi oğlu o qadının başına bir libas salardı. Yəni bu qadın mənimdir, mən buna varisəm, o vaxt da o qadın başqa şəxsə ərə gedə bilməzdi. 2-ci hökm - əgər bir şəxs öz qadınını sevməyib, ondan xoşlanmasaydı, ona zülm və əziyyət edərdi. Ta ki o qadına verdiyi mehriyyəni ondan

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا يَحِلُّ لَكُمْ أَنْ تَرِثُوا النِّسَاءَ كَرْهًا وَلَا تَعْضُلُوهُنَّ لِتَذْهَبُوا بِبَعْضِ مَا آتَيْتُمُوهُنَّ إِلَّا أَنْ يَأْتِينَ بِفَاحِشَةٍ مُبَيِّنَةٍ وَعَاشِرُوهُنَّ بِالْمَعْرُوفِ فَإِنْ كَرِهْتُمُوهُنَّ فَعَسَى أَنْ تَكْرَهُوا شَيْئًا وَيَجْعَلَ اللَّهُ فِيهِ خَيْرًا كَثِيرًا ﴿١٩﴾ وَإِنْ أَرَدْتُمُ اسْتِبْدَالَ زَوْجٍ مَكَانَ زَوْجٍ وَآتَيْتُمْ إِحْدَاهُنَّ قِنْطَارًا فَلَا تَأْخُذُوا مِنْهُ شَيْئًا أَتَأْخُذُونَهُ بُهْتَانًا وَإِثْمًا مُبِينًا ﴿٢٠﴾

---

artıqlaması ilə alıb, elə boşayardı. Necə ki bizim bu zəmanəmizdə də xalq bu çirkin işə əməl edir. Bu iki hökmə görə Allah-Təala bu ayəni nazil etdi).

**19) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) - ey iman gətirən şəxslər, (لَا يَحِلُّ لَكُمْ أَنْ تَرِثُوا النِّسَاءَ كَرْهًا) - ərləri ölən qadınları zorla alıb mala varis olan kimi, onlara varis olmaq sizə halal və caiz deyildir. Öz ixtiyarları ilə kimi istəsələr, özlərinə ər seçərlər. (وَلَا تَعْضُلُوهُنَّ) - bir də qadınlara zülm edib onları həbs etməyin. (لِتَذْهَبُوا بِبَعْضِ مَا آتَيْتُمُوهُنَّ) – ta ki zülm etmək səbəbinə qadınlara verdiyiniz o mehriyyənin bəzisini alıb götürəsiniz.** (Yəni boşanmaq üçün qadınlardan zülmlə bir şey almaq caiz deyildir). **(إِلَّا أَنْ يَأْتِينَ بِفَاحِشَةٍ مُبَيِّنَةٍ) – boşanmaq üçün qadınlardan bir şey almaq olmaz, ancaq açıq-aşkar zina etsələr, zina səbəbinə onları həbs etmək olar, ta ki əvəzini verib boşansınlar. (وَعَاشِرُوهُنَّ بِالْمَعْرُوفِ) - əlbəttə, qadınlarla yaxşı və gözəl şəkildə rəftar edin. Səbəbsiz yerə onlara əziyyət etməyin. (فَإِنْ كَرِهْتُمُوهُنَّ) - əgər qadınları sevməyib, onlardan xoşlanmasanız da, yenə səbəbsiz yerə onları boşamaq caiz deyil. (فَعَسَى أَنْ تَكْرَهُوا شَيْئًا) – o şeyi ki xoşlamırsınız, ümid edilir ki, (وَيَجْعَلَ اللَّهُ فِيهِ خَيْرًا كَثِيرًا) - Allah-Təala həmin şeydə sizdən ötrü çox xeyir və mənfəət vermiş olsun.** (Amma siz ondan agah deyilsiniz).

**20) (وَإِنْ أَرَدْتُمُ اسْتِبْدَالَ زَوْجٍ مَكَانَ زَوْجٍ وَآتَيْتُمْ إِحْدَاهُنَّ قِنْطَارًا فَلَا تَأْخُذُوا مِنْهُ شَيْئًا أَتَأْخُذُونَهُ بُهْتَانًا وَإِثْمًا مُبِينًا) - əgər *bir qadını boşayıb, onun əvəzində başqa bir qadın almaq istəsəniz, boşanan qadına mehriyyədən ötrü çox mal vermiş olsanız da, boşayanda onlardan o maldan bir şey almayın. Necə ala bilərsiniz? Halbuki nəsə almaq açıq-aşkar günahdır.**

*(****Qeyd:*** Ayə işarə edir ki, İslam şəriətində qadınlara verilən mehriyyədə müəyyən bir hədd yoxdur, onlara mehriyyə kimi çox mal da vermək olar, çünki ayədə (qantar) çox mal mənasındadır. Zəməxşəri "Kəşşaf"da nəql edib deyir: "Ömər ibn Xəttab xəlifə olanda minbərdə xütbəni bitirəndən sonra dedi: "Ey insanlar, qadınların mehriyyəsini çox verməyin. Əgər Allah-Təala yanında artıq mehriyyə vermək yaxşı bir əməl olsaydı, hər halda sizdən əvvəl Hz. Peyğəmbər onu edərdi. Halbuki heç bir qadına 12 oqqa* gümüşdən artıq mehriyyə vermədi". Bir qadın ayağa durub dedi: "Ey əmirəl-möminin, niyə Allah-Təalanın bizə verdiyi haqqa mane olursan? Allah-Təala Qurani-Şərifdə buyurur: "Əgər qadınlara bir (qantar) qızıl mehriyyə versəniz də caizdir və rəvadır". Amma sən deyirsən ki, mehriyyəni artıq verməyin". Ömər bu sözü eşidəndə dedi: "Hamı Ömərdən alimdir". Ondan sonra üzünü səhabələrə*

وَكَيْفَ تَأْخُذُونَهُ وَقَدْ أَفْضَى بَعْضُكُمْ إِلَى بَعْضٍ وَأَخَذْنَ مِنْكُمْ مِيثَاقًا غَلِيظًا ﴿٢١﴾ وَلَا تَنْكِحُوا مَا نَكَحَ آبَاؤُكُمْ مِنَ النِّسَاءِ إِلَّا مَا قَدْ سَلَفَ إِنَّهُ كَانَ فَاحِشَةً وَمَقْتًا وَسَاءَ سَبِيلًا ﴿٢٢﴾ حُرِّمَتْ عَلَيْكُمْ أُمَّهَاتُكُمْ وَبَنَاتُكُمْ وَأَخَوَاتُكُمْ وَعَمَّاتُكُمْ وَخَالَاتُكُمْ وَبَنَاتُ الْأَخِ وَبَنَاتُ الْأُخْتِ وَأُمَّهَاتُكُمُ اللَّاتِي أَرْضَعْنَكُمْ وَأَخَوَاتُكُمْ مِنَ الرَّضَاعَةِ

---

*tutub dedi: "Siz məndən bu sözü eşidirsiniz ki, deyirəm, niyə mənə cavab vermirsiniz? Halbuki məni elə bir qadın rədd edir ki, qadınların arasında çox da alim biri deyil". "Səhvini iqrar edən böyük pəhləvandır", insafsızlar Ömərin insaf və mürüvvətinə baxsınlar (Buxari, Təfsir, Nisa 6; Əbu Davud Nikah 23)).*

*(*Qeyd: 1 oqqa – oqiyyə 7 misqal yarımdır, 1 misqal 4,65 qr-dır).*

**21) (وَكَيْفَ تَأْخُذُونَهُ وَقَدْ أَفْضَى بَعْضُكُمْ إِلَى بَعْضٍ وَأَخَذْنَ مِنْكُمْ مِيثَاقًا غَلِيظًا) - necə ola bilər ki, verdiyiniz mehriyyəni qadınlardan geri alasınız? Halbuki sizin aranızda yaxınlıq və əlaqə meydana gəlibdir. Sizinlə yoldaşlıq edib, yaxın olduqları üçün qadınlar sizdən möhkəm əhd-peyman almışdılar.** (Amma əgər qadını cinsi əlaqədən əvvəl boşasalar, mehriyyənin yarısı qadına çatar).

**22) (وَلَا تَنْكِحُوا مَا نَكَحَ آبَاؤُكُمْ مِنَ النِّسَاءِ إِلَّا مَا قَدْ سَلَفَ إِنَّهُ كَانَ فَاحِشَةً وَمَقْتًا وَسَاءَ سَبِيلًا) -** (cahiliyyə zamanında oğul atanın xanımı ilə evlənərdi, bu ayə onun haram olması haqqında nazil oldu). **Ata-babalarınızın nikahlandığı qadınlarla siz evlənməyin. Ancaq o ki, cahiliyyə zamanı olubdur, onlar bağışlanıb. Həqiqətən, bu nikah zinadır və Allah-Təalanın düşmənçiliyinə səbəbdir, atanın xanımı ilə evlənmək qəbih olan yola getməkdir.** (Atanın nikahında olan qadın onunla yaxınlıq etməsə də, oğula haramdır. Sıradakı ayədə Allah-Təala islam şəriətinə görə, evlənilməsi haram olan qadınları bəyan edir. Haram olmaq ya soy baxımındandır, ya da səbəb baxımındandır. Səbəbi iki qisimdir, ya süd əmməklədir, (yəni bir uşaq bir qadından süd əmər), ya da evlənməklədir (yəni bir yerdən qız almaqla onlarla qohum olmaqladır). Bu qeyd olunan üç cəhət və bundan sonra qeyd olunan qadınlarla evlənmək haramdır).

**23) (حُرِّمَتْ عَلَيْكُمْ) - islam şəriətində bundan sonra qeyd olunan qadınlarla evlənmək sizə haram oldu. (أُمَّهَاتُكُمْ) - analarınız, (وَبَنَاتُكُمْ) - qızlarınız, (وَأَخَوَاتُكُمْ) - bacılarınız, (وَعَمَّاتُكُمْ) - bibiləriniz, (وَخَالَاتُكُمْ) - xalalarınız, (وَبَنَاتُ الْأَخِ) - qardaş qızları, (وَبَنَاتُ الْأُخْتِ) - bacı qızları,** (bu 7 növ qadın soy baxımından haramdır), **(وَأُمَّهَاتُكُمُ اللَّاتِي أَرْضَعْنَكُمْ) - və haramdır sizə bundan başqa o analar ki, sizə süd veribdir. (وَأَخَوَاتُكُمْ مِنَ الرَّضَاعَةِ) - bir də süd bacılarınız sizə haramdır.** Hərçənd ayədə süd baxımından haram olan iki nəfər qeyd olunubdur, amma Hz. Peyğəmbər ayənin hökmüylə süd əmməyi də soy kimi sayıbdır: "Soy baxımından haram olan hər qadın süd əmmək baxımından da

وَأُمَّهَاتُ نِسَائِكُمْ وَرَبَائِبُكُمُ اللاَّتِي فِي حُجُورِكُمْ مِنْ نِسَائِكُمُ اللاَّتِي دَخَلْتُمْ بِهِنَّ فَإِنْ لَمْ تَكُونُوا دَخَلْتُمْ بِهِنَّ فَلاَ جُنَاحَ عَلَيْكُمْ وَحَلاَئِلُ أَبْنَائِكُمُ الَّذِينَ مِنْ أَصْلاَبِكُمْ

---

haramdır" (Buxari, Şəhadət 7; Kuleyni, Kafi, II/39; Müslüm, Rada 1-2-9-12; Tusi, Təhzib, VII/313-İstibsar, III/194; Əbu Davud, Nikah 6; İbn Macə, Sünən, Nikah 34), məsələn, bir uşaq bir qadının südünü içsə, o qadın o uşağın anasıdır. O qadının əri onun atasıdır. O qadının uşaqları bu kişidən olsunlar, ya da başqa kişidən, fərqi yoxdur, süd uşaqları olsa, o süd içən uşağın qardaş və bacılarıdır. O qadının bacısı o uşağın xalasıdır, o kişinin bacısı o uşağın bibisidir. Süd əmməklə soy arasında heç bir fərq yoxdur. Hər o qadın ki, soy baxımından haramdır, süd əmmək baxımından da haramdır. Süd ilə haram olmaqda bir neçə şərt vardır: 1. O süd, gərək, doğum südü olsun, yəni qadın doğsun və ondan süd əmələ gəlsin. O vaxt o süddən əgər bir uşaq içsə, o qadının yuxarıda qeyd olunan qohumları ona haram olar, amma əgər doğmamış bir qadının südü olub bir uşağa o süddən versə, onlar ona haram olmaz. 2. Gərək, o qadının doğumu şəriət nikahı ilə olsun, əgər zina yolu ilə doğsa, o süddən bir uşağa versə, onlar ona haram olmaz. 3. Bir gün, ya da bir gecə, ya da 15 dəfə o qadından süd içməlidir, əgər bundan az içsə, yenə onlar ona haram olmaz. 4. Bir gün, bir gecə, ya da 15 dəfə arasında bir dəfə başqa qadından , ya da öz anasından süd içsə, məsələn, gecəni bir qadından süd içsə, ondan sonra bir başqa qadından bir dəfə süd içsə, ondan sonra yenə o gün birinci qadından süd içsə, tamamən, ya da 5 dəfə bir qadından süd içsə, ondan sonra 15 ədədi tamam olana qədər yenə 10 dəfə birinci qadından süd içsə, hər iki halda onlar haram olmaz. 5. Gərək, o süd içən uşağın 2 yaşı tamam olmasın, əgər iki yaşı tamam olandan sonra süd içsə, onlar haram olmaz. Bu məsələ süd əmmək haqqında müxtəsər şəkildə qeyd olundu ki, bu kitaba baxanlar bəsirətli olsunlar, yoxsa bu məsələlərin yeri bu kitab deyildir. 4 növ qadın da evlənmə (qız alma) yolu ilə haram sayılır. 3 qismi əsl haram olanlardır ki, heç vaxt onlar halal olmaz, bir qismi müvəqqətidir, müvəqqətilik ünsürü yox olandan sonra haramlığı qalxıb halal olar. Əsl haram olan bu üç növdür ki, qeyd olunur:) **(وَأُمَّهَاتُ نِسَائِكُمْ) - haramdır sizə qadınlarınızın anaları,** (elə ki bir şəxs bir qadınla evləndi, nikah sayəsində o qadının anası o şəxsə haram olar, ona yaxınlaşmamış qadını boşasa da, onun anasını ala bilməz. Çünki nikahlanmaqla qadının anası ona haram olar). **(وَرَبَائِبُكُمُ اللاَّتِي فِي حُجُورِكُمْ مِنْ نِسَائِكُمُ اللاَّتِي دَخَلْتُمْ بِهِنَّ) - bir də haramdır sizə əlaqədə olduğunuz o qadınların qızları ki, onlara tərbiyə veribsiniz.** (Yəni bir şəxs bir qadınla evlənsə, o qadının əvvəlki ərindən qızı varsa, o şəxs o qadınla əlaqədə olandan sonra o qız o şəxsə haram olar. Əgər yaxınlıq etməmiş o qadını boşasa, onun qızını ala bilər. Amma qadının anası belə deyildir. Necə ki qeyd edildi, qadının anası nikah sayəsində o kişiyə haram olar). **(فَإِنْ لَمْ تَكُونُوا دَخَلْتُمْ بِهِنَّ فَلاَ جُنَاحَ عَلَيْكُمْ) - əgər qadınlarla əlaqədə olmayıb, onları boşasanız, o vaxt onların qızlarını almaqda sizə heç bir günah yoxdur. (وَحَلاَئِلُ أَبْنَائِكُمُ الَّذِينَ مِنْ أَصْلاَبِكُمْ) - bir**

وَأَنْ تَجْمَعُوا بَيْنَ الْأُخْتَيْنِ إِلَّا مَا قَدْ سَلَفَ إِنَّ اللَّهَ كَانَ غَفُورًا رَحِيمًا ﴿٢٣﴾ وَالْمُحْصَنَاتُ مِنَ النِّسَاءِ
إِلَّا مَا مَلَكَتْ أَيْمَانُكُمْ كِتَابَ اللَّهِ عَلَيْكُمْ وَأُحِلَّ لَكُمْ مَا وَرَاءَ ذَلِكُمْ أَنْ تَبْتَغُوا بِأَمْوَالِكُمْ مُحْصِنِينَ
غَيْرَ مُسَافِحِينَ فَمَا اسْتَمْتَعْتُمْ بِهِ مِنْهُنَّ فَآتُوهُنَّ أُجُورَهُنَّ فَرِيضَةً وَلَا جُنَاحَ عَلَيْكُمْ فِيمَا تَرَاضَيْتُمْ بِهِ
مِنْ بَعْدِ الْفَرِيضَةِ إِنَّ اللَّهَ كَانَ عَلِيمًا حَكِيمًا ﴿٢٤﴾

---

**də haramdır sizə öz nəslinizdən olan oğullarınızın qadınları,** (oğlanlar əgər qadınlarını boşasalar, ataya onları almaq haramdır. Hərçənd oğlanlar onlarla yaxınlıq etməmiş də boşasalar belədir, çünki oğlun xanımı nikah sayəsində ataya haram olar, necə ki atanın xanımı nikah sayəsində oğula haram olur. Haramlığı müvəqqəti olan 3 qisim qadın da bunlardır:) **(وَأَنْ تَجْمَعُوا بَيْنَ الْأُخْتَيْنِ إِلَّا مَا قَدْ سَلَفَ) - haramdır sizə iki bacını bir yerdə almaq, hər ikisini bir yerdə özünüzə xanım etmək, ancaq keçmişdə olanlar olub-keçibdir. Amma sizə haramdır.** (Bu haramlıq müvəqqətidir, çünki iki bacını bir yerdə almaq haramdır, ayrı-ayrılıqda haram deyil. Birini alıb boşayandan sonra, ya da vəfat edəndən sonra o birini də almaq olar). **(إِنَّ اللَّهَ كَانَ غَفُورًا رَحِيمًا) - iki bacını alıb, ondan sonra tövbə edib onu tərk edən şəxslərə Allah-Təala rəhm edib, onları bağışlayandır.** (Əvvəlki peyğəmbərlərin zamanında iki bacını almaq caiz idi, Yaqub peyğəmbər dayısının iki qızını bir yerdə almışdı, böyüyünün adı Lea, kiçiyinin adı Rahel olub Yusifin anası idi).

**24) (وَالْمُحْصَنَاتُ مِنَ النِّسَاءِ) - bir də ərdə olan qadınlar sizə haramdır.** (Əri olan qadını almaq caiz deyildir). **(إِلَّا مَا مَلَكَتْ أَيْمَانُكُمْ) - ancaq müşriklərlə cihad edən vaxt əsir edib sahib olduğunuz ərli qadınlar istisnadır. O qadınlar sizə halaldır. (كِتَابَ اللَّهِ عَلَيْكُمْ) - haram olan o qadınlar ki, qeyd olundu, o, Allah-Təalanın hökmüdür, sizdən ötrü yazılıb, heç vaxt dəyişilməz. Həmişə sizə haramdır. (وَأُحِلَّ لَكُمْ مَا وَرَاءَ ذَلِكُمْ) - amma bu qeyd olunan qadınlardan başqası sizə halaldır. (أَنْ تَبْتَغُوا بِأَمْوَالِكُمْ مُحْصِنِينَ غَيْرَ مُسَافِحِينَ) - Allah-Təalanın istəyi budur ki, siz ismət sahibi olub, zinakar olmayıb halal qadınları axtarıb tapıb, onlara öz malınızdan mehriyyə verəsiniz. (فَمَا اسْتَمْتَعْتُمْ بِهِ مِنْهُنَّ فَآتُوهُنَّ أُجُورَهُنَّ فَرِيضَةً) – evlənəndən sonra ləzzət aldığınız qadınların mehriyyələrini verin.** (Çünki mehriyyə ləzzət almağın qarşılığındadır. Bu mehriyyəni vermək vacibdir, gərək, vacibə əməl edəsiniz). **(وَلَا جُنَاحَ عَلَيْكُمْ فِيمَا تَرَاضَيْتُمْ بِهِ مِنْ بَعْدِ الْفَرِيضَةِ) - siz ər və arvad bir məbləğə razı olub mehriyyəni müəyyənləşdirəndən sonra əgər onu dəyişdirib, başqa bir mehriyyə müəyyən etsəniz, onda sizə heç bir günah yoxdur.** (Yəni mehriyyəni müəyyən edəndən sonra qadın mehriyyəsinin tamamını, ya da yarısını, məsələn, ərinə bağışlasa, ya da əri onun mehriyyəsini artıq versə, heç bir günah yoxdur). **(إِنَّ اللَّهَ كَانَ عَلِيمًا حَكِيمًا) - həqiqətən, Allah-Təala bəndələrinin əhvalından agahdır, onlarla hikmət üzrə rəftar edəndir.** (Sıradakı ayə kənizlə evlənmək barəsində nazil olubdur, ondan ötrü Allah-Təala 3 şərt qoşubdur: Allah-Təala razı deyil ki, azad şəxs

وَمَنْ لَمْ يَسْتَطِعْ مِنْكُمْ طَوْلًا أَنْ يَنْكِحَ الْمُحْصَنَاتِ الْمُؤْمِنَاتِ فَمِنْ مَا مَلَكَتْ أَيْمَانُكُمْ مِنْ فَتَيَاتِكُمُ الْمُؤْمِنَاتِ وَاللَّهُ أَعْلَمُ بِإِيمَانِكُمْ بَعْضُكُمْ مِنْ بَعْضٍ فَانْكِحُوهُنَّ بِإِذْنِ أَهْلِهِنَّ وَآتُوهُنَّ أُجُورَهُنَّ بِالْمَعْرُوفِ مُحْصَنَاتٍ غَيْرَ مُسَافِحَاتٍ وَلَا مُتَّخِذَاتِ أَخْدَانٍ فَإِذَا أُحْصِنَّ فَإِنْ أَتَيْنَ بِفَاحِشَةٍ فَعَلَيْهِنَّ نِصْفُ مَا عَلَى الْمُحْصَنَاتِ مِنَ الْعَذَابِ ذَلِكَ لِمَنْ خَشِيَ الْعَنَتَ مِنْكُمْ وَأَنْ تَصْبِرُوا خَيْرٌ لَكُمْ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿٢٥﴾

---

kənizi özünə arvad etsin, ancaq bu 3 şərtlə icazə verir: 1. Gərək, o şəxsin azad qadın almağa maliyyə imkanı olmasın, əgər azad qadın almağa imkanı varsa, kənizlə evlənə bilməz). 2. Gərək, o kənizin sahibinin izni olsun, sahibindən izinsiz onunla evlənə bilməz. 3. Gərək, o şəxs kənizlə də evlənməsə zinaya düşməkdən qorxsun. Bu 3 şərt mövcud olandan sonra kənizlə evlənə bilər, bu şərtlər kənizlə evlənmə şərtləridir. Amma kənizə malik olan şəxsin onu özünə arvad etməsi üçün heç bir şərt yoxdur).

**25) (وَمَنْ لَمْ يَسْتَطِعْ مِنْكُمْ طَوْلًا أَنْ يَنْكِحَ الْمُحْصَنَاتِ الْمُؤْمِنَاتِ) – sizdən kimin mömin və saleh azad qadınlarla evlənməyə mal baxımından imkanı olmasa,** (bu, kənizlə evlənməyin birinci şərtidir), (فَمِنْ مَا مَلَكَتْ أَيْمَانُكُمْ مِنْ فَتَيَاتِكُمُ الْمُؤْمِنَاتِ) **- o vaxt sizə caizdir ki, əlinizdə olan mömin kənizləri alasınız.** (وَاللَّهُ أَعْلَمُ بِإِيمَانِكُمْ) **- Allah-Təala sizin imanınızdan agahdır, bilir ki, sizin imanınız artıqdır, yoxsa kənizlərin imanı, Allah-Təalanın yanında əsas olan imandır.** (بَعْضُكُمْ مِنْ بَعْضٍ) **- siz möminlər və mömin kənizlər bir-birinizdənsiniz. (Çünki imanda şəriksiniz. Azad qadınla evlənmək imkanınız olmadıqda),** (فَانْكِحُوهُنَّ بِإِذْنِ أَهْلِهِنَّ) **– sahiblərinin izniylə mömin kənizlərlə evlənin,** (bu 2-ci şərtdir). (وَآتُوهُنَّ أُجُورَهُنَّ بِالْمَعْرُوفِ) **- kənizlərin mehriyyələrini yaxşı şəkildə verib onlara əziyyət etməyin.** (مُحْصَنَاتٍ غَيْرَ مُسَافِحَاتٍ) - (kənizlərə nəsihətdir), **gərək, o kənizlər iffətli və saleh olub zinakar olmasınlar.** (وَلَا مُتَّخِذَاتِ أَخْدَانٍ) **- və gizlində də özlərindən ötrü aşna tutmasınlar.** (فَإِذَا أُحْصِنَّ) **- ərə getdikdən sonra,** (فَإِنْ أَتَيْنَ بِفَاحِشَةٍ) **- əgər zina etsələr,** (فَعَلَيْهِنَّ نِصْفُ مَا عَلَى الْمُحْصَنَاتِ مِنَ الْعَذَابِ) **- azad olan qadınların əzabının yarısı qədər gərək, evli* olan kənizlərə əzab edilsin.** (Azad zinakar qadının cəzası 100 qamçıdır).

*(*Qeyd: Ərdə olan kənizin cəzası, gərək, ərdə olan azad qadının cəzasının yarısı qədər olsun. Ərli azad qadının zina cəzası rəcmdir (daşqalaq edilmədir). Bunun yarısı təsəvvür edilməz. O səbəbdən ərli kənizin zina cəzası subay azad qadının zina cəzasının yarısı qədər - 50 qamçı təyin edildi).*

(ذَلِكَ) **– bu, kənizlə evlənmək,** (لِمَنْ خَشِيَ الْعَنَتَ مِنْكُمْ) **- siz möminlərdən zinanın zərər və məşəqqətinə düşməkdən qorxan şəxslərə caizdir.** (Yəni əgər kəniz almasa, azad qadın almaq da ona müyəssər olmasa, zinaya düşəcəyi üçün kəniz ala bilər). (Bu 3-cü şərtdir ki, əvvəldə qeyd olundu). (وَأَنْ تَصْبِرُوا خَيْرٌ لَكُمْ) **- amma əgər səbir edib,** (azad qadın ala bilənə qədər nəfsinizi kənizlə evlənməkdən qorusanız), **sizdən ötrü bu, yaxşıdır.** (وَاللَّهُ غَفُورٌ رَحِيمٌ) **- Allah-**

يُرِيدُ اللَّهُ لِيُبَيِّنَ لَكُمْ وَيَهْدِيَكُمْ سُنَنَ الَّذِينَ مِنْ قَبْلِكُمْ وَيَتُوبَ عَلَيْكُمْ وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿٢٦﴾ وَاللَّهُ يُرِيدُ أَنْ يَتُوبَ عَلَيْكُمْ وَيُرِيدُ الَّذِينَ يَتَّبِعُونَ الشَّهَوَاتِ أَنْ تَمِيلُوا مَيْلًا عَظِيمًا ﴿٢٧﴾ يُرِيدُ اللَّهُ أَنْ يُخَفِّفَ عَنْكُمْ وَخُلِقَ الْإِنْسَانُ ضَعِيفًا ﴿٢٨﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَأْكُلُوا أَمْوَالَكُمْ بَيْنَكُمْ بِالْبَاطِلِ إِلَّا أَنْ تَكُونَ تِجَارَةً عَنْ تَرَاضٍ مِنْكُمْ وَلَا تَقْتُلُوا أَنْفُسَكُمْ إِنَّ اللَّهَ كَانَ بِكُمْ رَحِيمًا ﴿٢٩﴾ وَمَنْ يَفْعَلْ ذَلِكَ عُدْوَانًا وَظُلْمًا فَسَوْفَ نُصْلِيهِ نَارًا وَكَانَ ذَلِكَ عَلَى اللَّهِ يَسِيرًا ﴿٣٠﴾

---

**Təala sizin günahlarınızı bağışlayıb, sizlərə rəhm edib, kənizlə evlənməyi caiz görübdür.**

**26) (يُرِيدُ اللَّهُ لِيُبَيِّنَ لَكُمْ وَيَهْدِيَكُمْ سُنَنَ الَّذِينَ مِنْ قَبْلِكُمْ وَيَتُوبَ عَلَيْكُمْ وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ) - Allah-Təalanın istəyi odur ki, dini ehkamı və sizə faydalı olanı bəyan etsin,** (o səbəbdən sizə kənizlə evlənməkdə 3 şərt qoşdu). (İstər ki,) **sizdən əvvəlki peyğəmbərlərin şəriətlərinə sizi hidayət edib bildirsin ki, halal və haram təkcə sizdə olmayıb, əvvəlki ümmətlərdən ötrü də halal və haram qoyulubdur.** (Necə ki Allah-Təala Qurani-Şərifdə bir neçə yerdə Tövratın bəzi ehkamlarını bəyan edibdir). **Və** (istər ki,) **hər bir müsibət və günahınızın tövbəsini sizdən qəbul etsin. Allah-Təala bəndələrinin xeyrindən agahdır. Onlardan ötrü hikmət üzrə ehkam veribdir.**

**27) (وَاللَّهُ يُرِيدُ أَنْ يَتُوبَ عَلَيْكُمْ وَيُرِيدُ الَّذِينَ يَتَّبِعُونَ الشَّهَوَاتِ أَنْ تَمِيلُوا مَيْلًا عَظِيمًا) - Allah-Təalanın istəyi odur ki, sizdən xeyir əməl meydana gəlsin ki, sizin tövbənizi qəbul etsin. Amma nəfsə tabe olan fasiq şəxslərin istəyi odur ki, sizi günaha salsın. Ta ki haqdan batil tərəfinə böyük meyil edəsiniz ki,** (islam dinindən çıxasınız, o vaxt da siz ilahi əzaba düçar olasınız).

**28) (يُرِيدُ اللَّهُ أَنْ يُخَفِّفَ عَنْكُمْ وَخُلِقَ الْإِنْسَانُ ضَعِيفًا) - Allah-Təalanın istəyi odur ki, dini ehkamı sizdən ötrü asan etsin. Ta ki harama düşməyəsiniz. Amma insan zəif şəkildə yaradılıbdır, səbir edib nəfsani arzularından özünü saxlayan deyildir.** (İlahi, insanı zəif halda yaradan sənsən, bu zəifliklə bizə rəhm edib, bizi cəzalandırma.

**29) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) - ey iman gətirən şəxslər, (لَا تَأْكُلُوا أَمْوَالَكُمْ بَيْنَكُمْ بِالْبَاطِلِ) - mallarınızı öz aranızda batil olan yolla yeməyin, (məsələn, oğurluq, xəyanət, qumar, faiz və qəsb yolları ilə mal yemək haramdır). (إِلَّا أَنْ تَكُونَ تِجَارَةً عَنْ تَرَاضٍ مِنْكُمْ) – ancaq qarşılıqlı razılıqla edilən ticarət yolu ilə mal qazanıb, ondan yeyin. (وَلَا تَقْتُلُوا أَنْفُسَكُمْ) – özünüz kimi olan şəxsləri qətlə yetirməyin. Siz hamınız vahid şəxs kimisiniz. Heç bir nəfəri qətlə yetirmək caiz deyildir. (إِنَّ اللَّهَ كَانَ بِكُمْ رَحِيمًا) - həqiqətən, Allah-Təala sizə rəhm edəndir.** (O səbəbdən zərərli şeyləri sizə qadağan edir).

**30) (وَمَنْ يَفْعَلْ ذَلِكَ عُدْوَانًا وَظُلْمًا فَسَوْفَ نُصْلِيهِ نَارًا وَكَانَ ذَلِكَ عَلَى اللَّهِ يَسِيرًا) - kim batil yolla xalqın malını yeyib, zülm və düşmənçilik edib birini öldürsə,**

إِنْ تَجْتَنِبُوا كَبَائِرَ مَا تُنْهَوْنَ عَنْهُ نُكَفِّرْ عَنْكُمْ سَيِّئَاتِكُمْ وَنُدْخِلْكُمْ مُدْخَلًا كَرِيمًا ﴿٣١﴾ وَلَا تَتَمَنَّوْا مَا
فَضَّلَ اللَّهُ بِهِ بَعْضَكُمْ عَلَى بَعْضٍ لِلرِّجَالِ نَصِيبٌ مِمَّا اكْتَسَبُوا وَلِلنِّسَاءِ نَصِيبٌ مِمَّا اكْتَسَبْنَ وَاسْأَلُوا
اللَّهَ مِنْ فَضْلِهِ إِنَّ اللَّهَ كَانَ بِكُلِّ شَيْءٍ عَلِيمًا ﴿٣٢﴾ وَلِكُلٍّ جَعَلْنَا مَوَالِيَ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ
وَالَّذِينَ عَقَدَتْ أَيْمَانُكُمْ

---

**tezliklə onu şiddətli odun əzabına yetirərik. Bu əzab etmək Allah-Təala üçün asandır. Heç bir günahkar onun qüdrətindən çıxa bilməz.**

**31)** (إِنْ تَجْتَنِبُوا كَبَائِرَ مَا تُنْهَوْنَ عَنْهُ نُكَفِّرْ عَنْكُمْ سَيِّئَاتِكُمْ وَنُدْخِلْكُمْ مُدْخَلًا كَرِيمًا) – (ey möminlər)**, əgər siz qadağan olunan böyük günahdan* çəkinsəniz, biz də sizin kiçik günahlarınızdan keçib bağışlayarıq. Sizi gözəl və hörmətli bir məkana daxil edərik.**

*(*__Qeyd:__ Böyük günahlar: zina, homoseksuallıq, adam öldürmə, qeybət, şərab içmək, qumar oynamaq, oğurluq kimi günahlar, kiçik günahlar: söyüş söymək, naməhrəmə pis gözlə baxmaq, boş sözlər danışmaq kimi günahlar).*

**32)** (وَلَا تَتَمَنَّوْا مَا فَضَّلَ اللَّهُ بِهِ بَعْضَكُمْ عَلَى بَعْضٍ) **- Allah-Təala sizdən bəzinizi digərlərinizə üstün edib. Böyük nemət və ruzilər bəxş etdiyi şəxsə həsəd edib, onda olan ruzini təmənna etməyin. Allah-Təala bəndələrinin əhvalından agahdır. Hər şəxsin öz səyinə görə, ona ruzi təyin edibdir. Heç bir şəxsə Allah-Təalanın işlərinə etiraz etmək caiz deyildir.** (لِلرِّجَالِ نَصِيبٌ مِمَّا اكْتَسَبُوا) **- kişilərdən ötrü öz qazandıqları şeylərdən pay və hissə vardır.** (وَلِلنِّسَاءِ نَصِيبٌ مِمَّا اكْتَسَبْنَ) **– qadınlardan ötrü də öz qazandıqları şeylərdən nəsib və hissə vardır.** (Allah-Təala hər bir şəxsə, kişi, ya da qadına qazanc və ticarətdəki səyinə görə öz nemətindən bəxş edər. Qazanc üçün səy edən səy etməyənlə bərabər olmaz. Bu ayə buna dəlildir ki, qadınların ticarətlə məşğul olması caiz və halaldır. Bir də şəxsin öz səyinə görə, Allah-Təala ona ruzi bəxş edər. Var-dövlət və nemət sahiblərinə həsəd etməyin, onlar səy edib ruzi üçün çalışdıqlarına görə, Allah-Təala da onlara böyük nemətlər bəxş edibdir. Allah-Təala xəsis deyil, əgər siz də onlar kimi səy edib ruzi üçün çalışsanız, Allah-Təala sizə də səyinizə görə lütf edər.)

(وَاسْأَلُوا اللَّهَ مِنْ فَضْلِهِ) **– qazanc üçün səy edib Allah-Təaladan istəyin ki, öz lütf və mərhəmətindən sizə ruzi bəxş etsin.** (إِنَّ اللَّهَ كَانَ بِكُلِّ شَيْءٍ عَلِيمًا) **- həqiqətən, Allah-Təala hər bir şeydən agahdır, hər bir şəxsin səyinə görə, ona ruzi bəxş edər.**

**33)** (وَلِكُلٍّ جَعَلْنَا مَوَالِيَ مِمَّا تَرَكَ الْوَالِدَانِ وَالْأَقْرَبُونَ) **- ata-ana və digər qohum-əqrəbalar dünyada nə ki qoyub gedirlər, onlardan ötrü varislər təyin etmişik. (Gərək, həmin varislər onlardan miras alsınlar, necə ki əvvəldə qeyd olundu).** (وَالَّذِينَ عَقَدَتْ أَيْمَانُكُمْ) **- bir də o şəxslər ki onlarla əhd edib, and**

فَآتُوهُمْ نَصِيبَهُمْ إِنَّ اللَّهَ كَانَ عَلَى كُلِّ شَيْءٍ شَهِيدًا ﴿٣٣﴾ الرِّجَالُ قَوَّامُونَ عَلَى النِّسَاءِ بِمَا فَضَّلَ
اللَّهُ بَعْضَهُمْ عَلَى بَعْضٍ وَبِمَا أَنْفَقُوا مِنْ أَمْوَالِهِمْ فَالصَّالِحَاتُ قَانِتَاتٌ حَافِظَاتٌ لِلْغَيْبِ بِمَا حَفِظَ اللَّهُ
وَاللَّاتِي تَخَافُونَ نُشُوزَهُنَّ فَعِظُوهُنَّ وَاهْجُرُوهُنَّ فِي الْمَضَاجِعِ وَاضْرِبُوهُنَّ فَإِنْ أَطَعْنَكُمْ

---

**içibsiniz ki, bir-birinizdən miras aparasınız, gərək, o əhdə vəfa olunsun. (فَآتُوهُمْ نَصِيبَهُمْ) - ey əhd edən şəxslərin varisləri, onlarla əhd edən şəxslərə paylarını verin.** (Bu şəkildə miras almaq cahiliyyə zamanında var idi. Şəriət onu təsdiq etmişdi. Bəzi təfsirçilər deyiblər: "Bu miras islamın ilk dövründə var idi, sonra hökmsüz edildi". Əhd edib and içənlərə bir-birilərinin malından öləndən sonra 6-da bir hissə verirdilər. Məsələn, iki nəfər bir-birinə deyərdi: "Mənim qanım sənin qanındır, mənimlə savaşan şəxslə, gərək, sən də savaşasan. Mənimlə sülh edən şəxslə gərək sən də sülh edəsən. Mən səndən miras alım, sən də məndən miras al". Elə ki bu sözləri deyib, bir-birilərinə and içdilər, hansı əvvəl ölsə, digəri onun malından 6-da bir hissə miras alardı). **(إِنَّ اللَّهَ كَانَ عَلَى كُلِّ شَيْءٍ شَهِيدًا) - həqiqətən, Allah-Təala bütün şeylərə şahid və agahdır.**

**34) (الرِّجَالُ قَوَّامُونَ عَلَى النِّسَاءِ) - kişilər qadınların bütün işlərinə və onlara ədəb verməyə qəyyumdurlar.** (Qadınlar da kişilərə itaət etməlidir)**. (بِمَا فَضَّلَ اللَّهُ بَعْضَهُمْ عَلَى بَعْضٍ) - bu itaət ona görədir ki, Allah-Təala kişiləri qadınlardan üstün edibdir.** (Kişilərdə olan yaxşı xüsusiyyətlər, güc-qüvvə qadınlarda olmaz, olsa da, az olar. Hər bir cəhətdən kişi qadından üstün olar. Bir bu səbəbə görə, Allah-Təala kişiləri qadınlardan fəzilətli etdi). **(وَبِمَا أَنْفَقُوا مِنْ أَمْوَالِهِمْ) - bir də o səbəbə görə ki, kişilər öz mallarından qadınlara sədəqə verib,** (onların xərcliyinə zamin olarlar. Qadınlar həmişə kişiyə möhtacdırlar. Bəzən elə olur ki, qadın da mal sahibi olur, mal sahibi olan əksər vaxtlarda da yenə kişilər öz mallarından onlara xərclik verərlər. Qadına möhtac olan az kişi olar). **(فَالصَّالِحَاتُ) -** (bu mübarək kəlam qadınlara nəsihətdir)**. Əlbəttə, gərək, qadınlar saleh olsunlar. (قَانِتَاتٌ) - ərlərinə itaət edib qadınlıq haqqını yerinə yetirsinlər. (حَافِظَاتٌ لِلْغَيْبِ بِمَا حَفِظَ اللَّهُ) - ərləri olmayanda da onların haqqını qoruyub ərlərinə xəyanət etməsinlər. Ona görə ki, Allah-Təala qadınların haqqını qoruyub, onları yaxşı şəkildə mühafizə etməyi əmr edibdir. (وَاللَّاتِي تَخَافُونَ نُشُوزَهُنَّ) –** (ərlərinə asi olma əlaməti görünən) **qadınların itaətdən çıxmağından qorxsanız, (فَعِظُوهُنَّ) – o vaxt əvvəlcə onlara öyüd-nəsihət edin. (وَاهْجُرُوهُنَّ فِي الْمَضَاجِعِ) – ikincisi, əgər öyüd-nəsihət ilə itaət etməsələr, onlarla bir yataqda yatmağı və cinsi əlaqəni tərk edin.** (Qadınların ən böyük qorxusu cinsi əlaqədən məhrum olmaqdır, ona görə, bəlkə, o vaxt itaət edərlər). **(وَاضْرِبُوهُنَّ) üçüncüsü, əgər itaət etməsələr, o vaxt da onları vurun.** (Elə vurun ki, onların bədənlərindən qan çıxmasın, qaralmasın, sümüyü sınmasın). **(فَإِنْ أَطَعْنَكُمْ) - əgər sizə itaət etsələr,** (nə gözəl iş

فَلَا تَبْغُوا عَلَيْهِنَّ سَبِيلًا إِنَّ اللَّهَ كَانَ عَلِيًّا كَبِيرًا ﴿٣٤﴾ وَإِنْ خِفْتُمْ شِقَاقَ بَيْنِهِمَا فَابْعَثُوا حَكَمًا مِنْ
أَهْلِهِ وَحَكَمًا مِنْ أَهْلِهَا إِنْ يُرِيدَا إِصْلَاحًا يُوَفِّقِ اللَّهُ بَيْنَهُمَا إِنَّ اللَّهَ كَانَ عَلِيمًا خَبِيرًا ﴿٣٥﴾ وَاعْبُدُوا
اللَّهَ وَلَا تُشْرِكُوا بِهِ شَيْئًا وَبِالْوَالِدَيْنِ إِحْسَانًا وَبِذِي الْقُرْبَى وَالْيَتَامَى وَالْمَسَاكِينِ وَالْجَارِ ذِي الْقُرْبَى
وَالْجَارِ الْجُنُبِ وَالصَّاحِبِ بِالْجَنْبِ وَابْنِ السَّبِيلِ وَمَا مَلَكَتْ أَيْمَانُكُمْ

---

görərlər), **(فَلَا تَبْغُوا عَلَيْهِنَّ سَبِيلًا) - daha o vaxt onlara əziyyət etmək üçün bir bəhanə, bir yol axtarmayın. (إِنَّ اللَّهَ كَانَ عَلِيًّا كَبِيرًا) - Allah-Təaladan qorxub səbəbsiz yerə onlara əziyyət etməyin. Həqiqətən, Allah-Təala hər bir şeydən ucadır.** (Onun sizə olan qüdrəti sizin qadınlara olan qüdrətinizdən artıqdır. Qadınlara görə sizdən intiqam alar. Sıradakı ayə kişiylə qadının arasını islah etməkdən ötrü nazil olubdur. Əgər qadın asi olub itaət etməsə, onların arasında bir mübahisə olsa, nə qədər mümkündür, gərək, onların arası islah edilib, boşanma olmasın. Elə ki islah mümkün olmadı, o vaxt boşanma olar).

**35) (وَإِنْ خِفْتُمْ شِقَاقَ بَيْنِهِمَا) - əgər qadın itaət etməyib, onların arasında ədavət olsa, mübahisə etməkdən qorxsanız, o vaxt islah etməyə çalışın. (فَابْعَثُوا حَكَمًا مِنْ أَهْلِهِ وَحَكَمًا مِنْ أَهْلِهَا) – kişinin qohum-əqrəbasından bir nəfər oyanıq, zirək şəxsi və yenə o xüsusiyyətdə qadının qohum-əqrəbasından bir şəxsi göndərin ki, onların arasında ədalətlə hökm etsinlər.** (Bu iki nəfər şəxs onların işlərinə baxsınlar, əgər ayrılığı məsləhət görsələr, boşansınlar, əgər birlikdə olmalarını məsləhət görsələr, evli qalmalarına hökm versinlər. Amma ən çox islah etməyə səy etsinlər). **(إِنْ يُرِيدَا إِصْلَاحًا) - əgər o iki nəfər hakimin niyyəti dürüst olsa ürəkdən nəsihət edib, islah etmək istəsə, (يُوَفِّقِ اللَّهُ بَيْنَهُمَا) - Allah-Təala da onların səylərinə və niyyətlərinə görə, ər və qadın arasına məhəbbət salıb, onları birləşdirər ki, araları islah olsun. (إِنَّ اللَّهَ كَانَ عَلِيمًا خَبِيرًا) - həqiqətən, ixtilaf edənləri birləşdirmək yolundan Allah-Təala agah və xəbərdardır.** (Ayə ər və qadının boşanması, ya da evliliyə davamında bu iki nəfər hakimin hökmünün qeydsiz-şərtsiz olması haqqında zahir və aşkardır. Amma üləmaların rəyi belədir ki, hakimlər boşanma hökmü versələr, ərin izni şərt olub ondan izinsiz boşamaq olmaz).

**36) (وَاعْبُدُوا اللَّهَ وَلَا تُشْرِكُوا بِهِ شَيْئًا) - Allah-Təalaya ibadət edin, heç bir şeyi ona şərik qoşmayın. (وَبِالْوَالِدَيْنِ إِحْسَانًا) - ata-ananıza ehsan verin. (وَبِذِي الْقُرْبَى وَالْيَتَامَى وَالْمَسَاكِينِ) - qohum-əqrəbalarınıza, yetim və yoxsullara ehsan verin, (وَالْجَارِ ذِي الْقُرْبَى) - xüsusən o yoxsullara* ki, sizə yaxın qonşudurlar** (divar qonşusudurlar), **(وَالْجَارِ الْجُنُبِ) - və o yaxın dosta ki həmişə sizinlə bir yerdə həmsöhbət olarlar.** (Yoxsulların arasında bu 3 qrupa daha artıq ehsan verin). **(وَالصَّاحِبِ بِالْجَنْبِ وَابْنِ السَّبِيلِ وَمَا مَلَكَتْ أَيْمَانُكُمْ) - bir də yol əsnasında xərclikləri bitən müsafirlərə və sahib olduğunuz qulam və kənizlərə.** (Bu qeyd olunan şəxslərə ehsan vermək və onlara qarşı təvazökar olmaq lazım-

إِنَّ اللَّهَ لَا يُحِبُّ مَنْ كَانَ مُخْتَالًا فَخُورًا ﴿٣٦﴾ الَّذِينَ يَبْخَلُونَ وَيَأْمُرُونَ النَّاسَ بِالْبُخْلِ وَيَكْتُمُونَ
مَا آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ وَأَعْتَدْنَا لِلْكَافِرِينَ عَذَابًا مُهِينًا ﴿٣٧﴾ وَالَّذِينَ يُنْفِقُونَ أَمْوَالَهُمْ رِئَاءَ النَّاسِ
وَلَا يُؤْمِنُونَ بِاللَّهِ وَلَا بِالْيَوْمِ الْآخِرِ

---

dır). **(إِنَّ اللَّهَ لَا يُحِبُّ مَنْ كَانَ مُخْتَالًا فَخُورًا) - həqiqətən, Allah-Təala təkəbbürlü və özünü öyən şəxsləri sevməz, xüsusən, qeyd olunan şəxslərə qarşı belə olanları heç sevməz.**

*(****Qeyd:** *Bu qeyd olunan şəxslər tamamən yoxsullar qrupuna daxildirlər. Amma bunları ayrı-ayrı qeyd etməyin səbəbi odur ki, gərək bunlara xüsusilə yardım edilməyə təşviq olunsun ki, ümmətin övladları dilənçi gününə düşməsinlər, Allah-Təala və Hz. Peyğəmbər razı olmaz ki, bir nəfər də müsəlman dilənçilik etsin, ar olsun müsəlmanlara! Bir də Allah-Təalanın bu qeyd olunan şəxslərə ehsan verməklə özünə ibadət edilib şərik qoşulmamasını birlikdə əmr etməkdə məqsədi ümmətin övladlarını dilənçilik zillətindən qurtarıb, onların zəiflik hallarına diqqəti cəlb etməkdir).*

**37) (الَّذِينَ يَبْخَلُونَ) - o şəxslər ki xəsislik** edib** (Allah-Təaladan ötrü, din və ümmətin tərəqqisi, yoxsulu kasıbçılıqdan qorumaq və ümmətin övladlarının zəmanənin şərtlərinə görə elm və bilik əldə etmələri üçün mallarını sərf etmirlər), **(وَيَأْمُرُونَ النَّاسَ بِالْبُخْلِ) - özləri*** xəsislik etməkdən başqa, xalqa da xəsislik etməyi əmr edirlər, (وَيَكْتُمُونَ مَا آتَاهُمُ اللَّهُ مِنْ فَضْلِهِ) – xəsislikdən əlavə Allah-Təalanın öz lütf və rəhmətindən bəxş etdiyi nemətləri gizlədirlər. Halbuki Allahın nemətini, gərək, həmişə aşkar edək. (وَأَعْتَدْنَا لِلْكَافِرِينَ عَذَابًا مُهِينًا) - kafirlərdən ötrü son dərəcə həqir və zəlil edən əzab hazırlamışıq.** (Bu ayə buna işarədir ki, xəsis olan şəxslər kafir və müşrik hökmündə olub onlarla əzabda şərikdirlər).

*(*****Qeyd:** *Xəsis şəxsdən məqsəd əlində olan maldan ümmətin övladlarına heç bir ehsan və yardım etməyənlərdir).*

*(******Qeyd:** *Bizim bu zəmanəmizdə əgər bir varlı şəxs ehsan vermək istəsə, başqa bir varlı şəxs nəinki onu məzəmmət edər, həm də bunu o ehsan edən şəxsə ya tamamilə qadağan edər, ya da elə bir az şeyin verilməsini əmr edər ki, bir dəyəri olmaz. Bu zəmanədə varlılar arasında xəsislik çox yayılıb. Ancaq bəzi şəxslərin qəlbinə Allah-Təala genişlik verib, ümmətin övladlarının yolunda, din və məzhəbin tərəqqisi yolunda mallarını sərf etməkdən çəkinməzlər. İslamın əvvəllərində müsəlmanlar din və ümmət yolunda bütün var-dövlətlərindən keçdilər. O səbəbdən az bir zamanda islam dini dünyaya yayıldı, amma bu zəmanədə çox zəngin şəxslərin əksəriyyəti din və ümmət yolunda bir dinar da sərf etmirlər. Belə şəxslər necə deyə bilərlər ki, biz Quran əhliyik və Qurana etiqadımız var. Bu məgər cəhalət və zəlalətin nəticəsi deyil?)*

**38) (وَالَّذِينَ يُنْفِقُونَ أَمْوَالَهُمْ رِئَاءَ النَّاسِ) - o şəxslər ki** (Allah-Təaladan ötrü yox, bəlkə) **riya və təriflənməkdən ötrü mallarını ehsan və sədəqə verirlər, (وَلَا يُؤْمِنُونَ بِاللَّهِ وَلَا بِالْيَوْمِ الْآخِرِ) - belə şəxslər nə Allah-Təalaya, nə də qiyamət**

وَمَنْ يَكُنِ الشَّيْطَانُ لَهُ قَرِينًا فَسَاءَ قَرِينًا ﴿٣٨﴾ وَمَاذَا عَلَيْهِمْ لَوْ آمَنُوا بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَأَنْفَقُوا مِمَّا
رَزَقَهُمُ اللَّهُ وَكَانَ اللَّهُ بِهِمْ عَلِيمًا ﴿٣٩﴾ إِنَّ اللَّهَ لَا يَظْلِمُ مِثْقَالَ ذَرَّةٍ وَإِنْ تَكُ حَسَنَةً يُضَاعِفْهَا وَيُؤْتِ مِنْ
لَدُنْهُ أَجْرًا عَظِيمًا ﴿٤٠﴾ فَكَيْفَ إِذَا جِئْنَا مِنْ كُلِّ أُمَّةٍ بِشَهِيدٍ وَجِئْنَا بِكَ عَلَى هَؤُلَاءِ شَهِيدًا ﴿٤١﴾
يَوْمَئِذٍ يَوَدُّ الَّذِينَ كَفَرُوا وَعَصَوُا الرَّسُولَ لَوْ تُسَوَّى بِهِمُ الْأَرْضُ وَلَا يَكْتُمُونَ اللَّهَ حَدِيثًا ﴿٤٢﴾

---

**gününə iman gətirən deyil.** (Allah-Təalaya iman gətirən şəxs şöhrət üçün malını sərf etməz, belə şəxslərin həmsöhbəti və yoldaşı şeytandır). **(وَمَنْ يَكُنِ الشَّيْطَانُ لَهُ قَرِينًا فَسَاءَ قَرِينًا) - şeytan kimin* yoldaşı olsa, onu pis əməllərə çəkəcəkdir və nə pis yoldaşdır şeytan.**

(Hər bir şəxsin nəfsi onun şeytanıdır. Hz. Peyğəmbər buyurdu: "Hər bir şəxsdən ötrü bir şeytan vardır". Soruşdular: "Ey Peyğəmbər, sənin də şeytanın var?" Buyurdu: "Bəli, amma mənim şeytanım mənə itaət edibdir" (Əhməd bin Hənbəl, Müsnəd, VI/115). Hz. Peyğəmbər doğru buyurub).

**39) (وَمَاذَا عَلَيْهِمْ لَوْ آمَنُوا بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَأَنْفَقُوا مِمَّا رَزَقَهُمُ اللَّهُ وَكَانَ اللَّهُ بِهِمْ عَلِيمًا) - əgər onlar Allah-Təalaya və axirət gününə iman gətirib Allah-Təala verən ruzidən onun yolunda və onun məmnunluğundan ötrü sədəqə və ehsan versəydilər, onlara nə zərər gələrdi?** (Əlbəttə, onlara bir zərər gəlməz, bəlkə, son dərəcə xeyir və mənfəətə nail olardılar. Allah-Təala onlardan və onların əməllərindən agahdır. Hər şəxsin öz əməlinə görə ona cəza verəcəkdir).

**40) (إِنَّ اللَّهَ لَا يَظْلِمُ مِثْقَالَ ذَرَّةٍ وَإِنْ تَكُ حَسَنَةً يُضَاعِفْهَا وَيُؤْتِ مِنْ لَدُنْهُ أَجْرًا عَظِيمًا) - həqiqətən, Allah-Təala heç kimə bir zərrə ağırlığında zülm etməz. Əgər o şəxsin o zərrə ağırlığı qədər savab əməli olsa, Allah-Təala onu o şəxsdən ötrü artırar. Və o şəxsə o əməlinin əvəzindən başqa, öz yanından böyük əcr və savab bəxş edər.**

**41) (فَكَيْفَ إِذَا جِئْنَا مِنْ كُلِّ أُمَّةٍ بِشَهِيدٍ وَجِئْنَا بِكَ عَلَى هَؤُلَاءِ شَهِيدًا) -** (ey Məhəmməd), **hər ümmətin öz peyğəmbərini onların əməllərinə şahidlik etməkdən ötrü gətirsək, kafir və müşriklərin əhvalı qiyamət günündə necə olar? O zaman səni də** (ey Məhəmməd)**, öz ümmətinin kafir və günahkarlarına şahidlik etməkdən ötrü gətirsək, bəs belə vaxtda günahlarını gizlədə bilərlərmi? Bəlkə, qiyamət günündə günahları aşkar olacaq və o günahların cəzası onlara veriləcəkdir.**

**42) (يَوْمَئِذٍ يَوَدُّ الَّذِينَ كَفَرُوا وَعَصَوُا الرَّسُولَ لَوْ تُسَوَّى بِهِمُ الْأَرْضُ وَلَا يَكْتُمُونَ اللَّهَ حَدِيثًا) - peyğəmbərlərin öz ümmətlərinin əməllərinə şahidlik etdikləri o gün** (qiyamət günü) **kafir olub Allah-Təalaya və peyğəmbərə asi olan şəxslər istəyərlər ki, ölüm onlara gəlib, kaş yerin altında qalıb, yerlə bir olub, heç dirilməyəydilər. Ogünkü gündə heç bir sözü Allah-Təaladan gizlətməyə**

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَقْرَبُوا الصَّلَاةَ وَأَنْتُمْ سُكَارَى حَتَّى تَعْلَمُوا مَا تَقُولُونَ وَلَا جُنُبًا إِلَّا عَابِرِي
سَبِيلٍ حَتَّى تَغْتَسِلُوا وَإِنْ كُنْتُمْ مَرْضَى أَوْ عَلَى سَفَرٍ أَوْ جَاءَ أَحَدٌ مِنْكُمْ مِنَ الْغَائِطِ أَوْ لَامَسْتُمُ النِّسَاءَ
فَلَمْ تَجِدُوا مَاءً فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا فَامْسَحُوا بِوُجُوهِكُمْ وَأَيْدِيكُمْ إِنَّ اللَّهَ كَانَ عَفُوًّا غَفُورًا ﴿٤٣﴾

---

**qadir olmazlar.** (Bir tərəfdən peyğəmbərlər və bir tərəfdən də orqanları onların əməllərinə şahidlik edərlər. Hz. Peyğəmbərin səhabələrindən Əbdürrəhman ibn Əfv yemək hazırlatdırıb,səhabələrdən bir neçə nəfəri qonaq dəvət etdi. Yemək yeyib şərab içdilər. (Hələ şərab haram edilməmişdi). Ondan sonra namaz vaxtı gəldi, bir nəfər də imam oldu, namaz qılmağa başladılar. İmam "Fatihə"dən sonra "Kafirun" surəsini oxudu, sərxoş olduğundan surəni dəyişdirib səhvən belə oxudu: "Mən sizin ibadət etdiklərinizə ibadət edərəm. Siz də mənim ibadət etdiyimə ibadət edərsiniz". Hz. Peyğəmbərin səhabələrindən bəzisi şərabın haram edilməsində çox israr edirdilər. Hamısından artıq da Ömər ibn Xəttab israr edirdi, gəlib əhvalatı Hz. Peyğəmbərə bildirdilər. (Əbu Davud, Əşribə 1) O vaxt da bu ayə nazil oldu ki, namaz vaxtı gərək sərxoş olmayasınız. Dedilər ki, ey Peyğəmbər, bu ayə şərabın haram olması üçün kafi deyil. İlahi, bunu bizdən ötrü açıq-aşkar bəyan et. Bir müddət sonra şərabın haramlığı barəsində ayə nazil oldu ki, "inşallah öz məqamında, bundan sonra gələn Maidə surəsinin 95-ci ayəsində qeyd olunacaqdır).

**43) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) - ey iman gətirən şəxslər, (لَا تَقْرَبُوا الصَّلَاةَ وَأَنْتُمْ سُكَارَى) - şərab içib sərxoş olduğunuz halda namaz qılmayın, (حَتَّى تَعْلَمُوا مَا تَقُولُونَ) – ta ki biləsiniz ki, namazda nə deyib, nə oxuyursunuz. (وَلَا جُنُبًا إِلَّا عَابِرِي سَبِيلٍ حَتَّى تَغْتَسِلُوا فَلَمْ تَجِدُوا مَاءً) –"cünüb"** (cinsi natəmizlik) **halətində məscidə daxil olub namaz qılmayın, ancaq yolu keçmək üçün məscidə daxil olmaq istisnadır, (məsələn: məscidin iki qapısı olsa, birindən girib, o birindən çıxmalı olsanız), nə qədər ki cünüb halətindəsiniz, məscidə daxil olmayın, ta ki qüsl edənə qədər. (وَإِنْ كُنْتُمْ مَرْضَى أَوْ عَلَى سَفَرٍ) - əgər naxoş və ya səfərdə olsanız, (أَوْ جَاءَ أَحَدٌ مِنْكُمْ مِنَ الْغَائِطِ) – ya da sizdən bir nəfər ayaqyolundan gəlsə,** (yəni əgər ayaqyolu etsə), **(أَوْ لَامَسْتُمُ النِّسَاءَ) – ya da qadınlarla yaxınlıq etsəniz, (فَلَمْ تَجِدُوا مَاءً)- bu qeyd olunan hallarda dəstəmaz, ya qüsldən ötrü su tapmasanız, (فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا) - pak olan torpaqla təyəmmüm edin. (Nəcis yerə təyəmmüm caiz deyildir, təyəmmüm ya qüsl əvəzinə, ya da dəstəmaz əvəzinədir, hər iki halda da su olmadıqda, o vaxt, gərək, təyəmmüm edilsin). (فَامْسَحُوا بِوُجُوهِكُمْ وَأَيْدِيكُمْ) - elə ki təyəmmüm etdiniz, ondan üzünüzə və əllərinizə məsh edin.** (Təyəmmüm bu şəkildədir: şəxs əllərinin içini pak olan yerə vurar, ondan sonra əllərini alnından (tük bitən yerdən) başıaşağı üzünə çəkər, ondan sonra sol əlini sağ əlinin dalına çəkər, buna* təyəmmüm deyilir. Elə ki su ilə mümkün olmadı, bu təyəmmümlə gərək namaz qılınsın). **(إِنَّ اللَّهَ كَانَ عَفُوًّا غَفُورًا) - əgər sizdə ya namazda, ya da təyəmmümdə bir nöqsan meyda-**

أَلَمْ تَرَ إِلَى الَّذِينَ أُوتُوا نَصِيبًا مِنَ الْكِتَابِ يَشْتَرُونَ الضَّلَالَةَ وَيُرِيدُونَ أَنْ تَضِلُّوا السَّبِيلَ ﴿٤٤﴾
وَاللَّهُ أَعْلَمُ بِأَعْدَائِكُمْ وَكَفَى بِاللَّهِ وَلِيًّا وَكَفَى بِاللَّهِ نَصِيرًا ﴿٤٥﴾ مِنَ الَّذِينَ هَادُوا يُحَرِّفُونَ الْكَلِمَ عَنْ
مَوَاضِعِهِ وَيَقُولُونَ سَمِعْنَا وَعَصَيْنَا وَاسْمَعْ غَيْرَ مُسْمَعٍ وَرَاعِنَا لَيًّا بِأَلْسِنَتِهِمْ وَطَعْنًا فِي الدِّينِ وَلَوْ
أَنَّهُمْ قَالُوا سَمِعْنَا وَأَطَعْنَا وَاسْمَعْ وَانْظُرْنَا

---

**na gəlsə, ondan sonra tövbə etsəniz, həqiqətən, Allah-Təala tövbə edənləri əfv edib bağışlayandır.**

*(*****Qeyd:*** *Təyəmmümdə üzə məsh etməyə ayənin işarəsi zahir və aşkardır, amma müftilər üzə məsh etməyi caiz görməyib, başda tük bitən yerdən qaşların üstünə qədər məsh etməyə fitva veriblər).*

**44) (أَلَمْ تَرَ إِلَى الَّذِينَ أُوتُوا نَصِيبًا مِنَ الْكِتَابِ)** – (ey Məhəmməd), **bəs yəhudilərin üləmasına baxmırsan ki, Tövrat elmindən bir hissə onlara verilibdir? (يَشْتَرُونَ الضَّلَالَةَ) - hidayətin əvəzinə zəlaləti alıb, yəhudilikdə qalıb haqq din olan islama daxil olmurlar, halbuki islamın haqq olmasının dəlili onlardan ötrü aşkardır. (وَيُرِيدُونَ أَنْ تَضِلُّوا السَّبِيلَ) - onların istəyi odur ki, siz möminlər haqq din olan islamdan kənar olub zəlalətdə olasınız. Necə ki onlar özləri zəlalətdə qalıblar.**

**45) (وَاللَّهُ أَعْلَمُ بِأَعْدَائِكُمْ) - Allah-Təala sizin düşmənlərinizdən sizdən artıq agahdır. Yəhudilərin sizə düşmən olmalarını sizə xəbər verir. (وَكَفَى بِاللَّهِ وَلِيًّا وَكَفَى بِاللَّهِ نَصِيرًا) - Allah-Təala dost və kömək olmaqda kifayət edər.**

**46) (مِنَ الَّذِينَ هَادُوا)- yəhudilərdən bir camaat vardır ki, (يُحَرِّفُونَ الْكَلِمَ عَنْ مَوَاضِعِهِ) - Tövratda olan Allah-Təala kəlmələrini və sözlərinin yerini dəyişdirib onun yerinə başqa kəlam qoyurlar. Allah-Təalanın kəlamının həqiqi mənasını dəyişdirib, xalqa ayrı cür bildirirlər.** (Necə ki bizim bu zəmanəmizdə Quranla belə rəftar edirlər). **(وَيَقُولُونَ)** – (ey Məhəmməd), **nə zaman sən yəhudiləri islama dəvət etsən, onlar sənə deyərlər: (سَمِعْنَا وَعَصَيْنَا) - "Sənin sözünü eşitdik, amma iman gətirməyib asi olduq". (وَاسْمَعْ غَيْرَ مُسْمَعٍ) - yəhudilər öz aralarında sənə bəddua edib deyirlər: "Bizdən bunu eşit: qulağın kar olsun, heç bir söz eşitməyəsən, biz də səndən xilas olaq". (وَرَاعِنَا) - amma zahirdə belə deyərlər: "Ey Məhəmməd, bizi gözləyib vaxt ver ki, sənin sözlərini fikirləşək". "Raina" kəlməsi yəhudi dilində söyüş** (çoban) **mənasındadır. Bu kəlməni deməklə peyğəmbəri təhqir etmək istəyirdilər. Bu əhvalat Bəqərə surəsinin 104-cü ayəsində təfsilatı ilə qeyd olunub). (لَيًّا بِأَلْسِنَتِهِمْ وَطَعْنًا فِي الدِّينِ) - bu sözləri yəhudilər dillərini haqdan batilə çevirib islama tənə etmək üçün deyirlər. (وَلَوْ أَنَّهُمْ قَالُوا سَمِعْنَا وَأَطَعْنَا وَاسْمَعْ وَانْظُرْنَا) - əgər yəhudilər desələr ki, ey peyğəmbər, sənin sözlərini eşidib itaət etdik, bizim sözümüzü eşidib bizə möhlət ver,** (yəni "raina" kəlməsinin əvəzinə

لَكَانَ خَيْرًا لَهُمْ وَأَقْوَمَ وَلَكِنْ لَعَنَهُمُ اللَّهُ بِكُفْرِهِمْ فَلَا يُؤْمِنُونَ إِلَّا قَلِيلًا ﴿٤٦﴾ يَا أَيُّهَا الَّذِينَ أُوتُوا
الْكِتَابَ آمِنُوا بِمَا نَزَّلْنَا مُصَدِّقًا لِمَا مَعَكُمْ مِنْ قَبْلِ أَنْ نَطْمِسَ وُجُوهًا فَنَرُدَّهَا عَلَى أَدْبَارِهَا أَوْ نَلْعَنَهُمْ
كَمَا لَعَنَّا أَصْحَابَ السَّبْتِ وَكَانَ أَمْرُ اللَّهِ مَفْعُولًا ﴿٤٧﴾ إِنَّ اللَّهَ لَا يَغْفِرُ أَنْ يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ
ذَلِكَ لِمَنْ يَشَاءُ وَمَنْ يُشْرِكْ بِاللَّهِ فَقَدِ افْتَرَى إِثْمًا عَظِيمًا ﴿٤٨﴾ اَلَمْ تَرَ اِلَى الَّذِينَ يُزَكُّونَ اَنْفُسَهُمْ ط
بَلِ اللّٰهُ يُزَكِّي مَنْ يَشَآءُ وَلَا يُظْلَمُونَ فَتِيلًا ﴿٤٩﴾

---

"unzurnə" kəlməsini desinlər), **əgər belə desələr, (لَكَانَ خَيْرًا لَهُمْ وَأَقْوَمَ) - hər halda bu söz onlardan ötrü daha yaxşı və möhkəmdir. (وَلَكِنْ لَعَنَهُمُ اللَّهُ بِكُفْرِهِمْ) - lakin Allah-Təala onlara küfrlərinin səbəbinə lənət edib, (فَلَا يُؤْمِنُونَ إِلَّا قَلِيلًا) - yəhudilərdən az olan şəxslərdən başqası iman gətirməzlər.**

**47) (يَا أَيُّهَا الَّذِينَ أُوتُوا الْكِتَابَ) - ey kitab** (Tövrat) **verilən şəxslər, (آمِنُوا بِمَا نَزَّلْنَا) - nazil etdiyimiz Qurana iman gətirin, (مُصَدِّقًا لِمَا مَعَكُمْ) - sizdə olan kitabı** (Tövratı) **təsdiq etdiyi halda** (Quranı nazil etdik)**, (مِنْ قَبْلِ أَنْ نَطْمِسَ وُجُوهًا) - o gündən** (qiyamət günündən) **qabaq o gün bəzi üzləri** (günahkarların üzlərini) **dəyişdirib, (فَنَرُدَّهَا عَلَى أَدْبَارِهَا) - arxa tərəflərinə döndərərik. Bəzisinə bu əzabı edərik. (أَوْ نَلْعَنَهُمْ) – ya da bəzisinə lənət edib öz rəhmətimizdən onları kənara salıb həmişəlik əzaba düçar edərik. (Yəhudilər bilməzlər ki, bu iki əzabın hansı onlara vaqe olar, amma Allah-Təala yanında məlumdur ki, onlara hansı əzab vaqe olacaq). (كَمَا لَعَنَّا أَصْحَابَ السَّبْتِ) - necə ki şənbə gününün haramlığını götürən yəhudilərə lənət edib həmişəlik əzaba düçar etdik. (وَكَانَ أَمْرُ اللَّهِ مَفْعُولًا) - Allah-Təalanın əmri və hökmü, əlbəttə, vaqe olandır.**

**48) (إِنَّ اللَّهَ لَا يَغْفِرُ أَنْ يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَنْ يَشَاءُ وَمَنْ يُشْرِكْ بِاللَّهِ فَقَدِ افْتَرَى إِثْمًا عَظِيمًا) - həqiqətən, Allah-Təala Ona şərik qoşan şəxsi bağışlamaz. Amma şirkdən başqa istədiyi şəxsin** (ancaq tövbə edən şəxsin) **günahlarını bağışlayar, kim Allah-Təalaya şərik qoşsa, həqiqətən, böyük günaha giribdir,** (o günah bağışlanan günah deyil)**.**

**49)* ( اَلَمْ تَرَ اِلَى الَّذِينَ يُزَكُّونَ اَنْفُسَهُمْ بَلِ اللّٰهُ يُزَكِّي مَنْ يَشَآءُ وَلَا يُظْلَمُونَ فَتِيلًا) -** (bu ayə o yəhudilərin barəsindədir ki, özlərini tərifləyib deyirdilər: Allah-Təalanın dostları bizik, bizə əzab etməyəcəkdir. Allah-Təala buyurur: "Ey Məhəmməd)**, bəs o yəhudilərə baxmırsan ki, özlərini tərifləyib təmiz çıxarırlar, şəxsin öz tərifi özünə fayda verməz. Əksinə, Allah-Təala istədiyini və layiq olanı tərifləyər, Allah-Təalanın tərifi insana fayda verər. Özlərini tərifləyənə Allah-Təala əzab edər və bu əzab etməkdə onlara xurma çəyirdəyində olan tel qədər zülm olunmaz, çünki hər bir şəxsin öz əməlinin cəzası ona veriləcəkdir.**

*(***Qeyd:** Fətil - xurma çəyirdəyinin ortasında olan telə deyilir).*

اُنْظُرْ كَيْفَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَؕ وَكَفٰى بِهٖٓ اِثْمًا مُبِينًا ﴿٥٠﴾ اَلَمْ تَرَ اِلَى الَّذٖينَ اُوتُوا نَصٖيبًا مِنَ
الْكِتَابِ يُؤْمِنُونَ بِالْجِبْتِ وَالطَّاغُوتِ وَيَقُولُونَ لِلَّذٖينَ كَفَرُوا هٰۤؤُلَٓاءِ اَهْدٰى مِنَ الَّذٖينَ اٰمَنُوا سَبٖيلًا
﴿٥١﴾ اُولٰٓئِكَ الَّذٖينَ لَعَنَهُمُ اللّٰهُؕ وَمَنْ يَلْعَنِ اللّٰهُ فَلَنْ تَجِدَ لَهُ نَصٖيرًاۜ ﴿٥٢﴾ اَمْ لَهُمْ نَصٖيبٌ مِنَ
الْمُلْكِ فَاِذًا لَا يُؤْتُونَ النَّاسَ نَقٖيرًاۙ ﴿٥٣﴾

---

**50)** (اُنْظُرْ كَيْفَ يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَط وَكَفٰى بِهٖٓ اِثْمًا مُبِينًا) – (ey Məhəmməd), **bu yəhudilərə bax ki, Allah-Təalaya iftira edib deyirlər: bizik Allah-Təalanın dostları, bizə əzab etməyəcəkdir, bu söz aşkar günah olmaqda onlara kifayət edər.** (Mədinə ətrafında olan yəhudilərin rəisləri Huyey ibn Axtəb və Kə`b ibnül-Əşrəf bir qrup adamla Məkkəyə getdilər ki, Məkkə əhliylə müttəfiq olub, birlikdə Mədinəyə gəlib, Hz. Peyğəmbərlə savaşıb, onun özünü və səhabələrini qətlə yetirib, islam dinini məhv etsinlər. Məkkə əhli dedi: "Siz əhli-kitabsınız, Məhəmmədə bizdən yaxınsınız, çünki onun da sizin kimi kitabı vardır, siz bizim bütlərimizə səcdə edənə qədər biz sizə arxayın olmarıq". Yəhudilər onların bütlərinə səcdə etdilər, bu ayə bu barədə nazil oldu).

**51)** (اَلَمْ تَرَ اِلَى الَّذٖينَ اُوتُوا نَصٖيبًا مِنَ الْكِتَابِ) – (ey Məhəmməd), **bəs Tövrat elmindən özlərinə bir hissə verilən o şəxslərə baxmırsan? (Bir onlara baxıb təəccüb et ki, onlardan necə əməl meydana gəlir).** (يُؤْمِنُونَ بِالْجِبْتِ وَالطَّاغُوتِ) - (yuxarıda qeyd olunan yəhudilər) **bütlərə və şeytana iman edib səcdə etdilər, (əhli -kitabın bütə səcdə etməsi çox təəccüblüdür. Yəhudilər bütə səcdə edəndən sonra Əbu Süfyan dedi: "Bəs bizim dinimiz yaxşıdır, yoxsa Məhəmmədin dini?" Kə`b ibnül-Əşrəf dedi: "Məhəmməd nə deyir?" Əbu Süfyan dedi: "Məhəmməd yeganə olan Allah-Təalanın ibadətinə əmr edib ona şərik qoşmağı qadağan edir". Kə`b dedi: "Sizin dininiz necədir?" Əbu Süfyan dedi: "Allah-Təala evinin xidmətçiləri - hacılara xidmət edən, qonaq saxlayan və borcluya kömək edən bizik". Kə`b dedi: "Sizin dininiz Məhəmmədin dinindən yaxşıdır". Bu mətləbi Allah-Təala peyğəmbərinə xəbər verib buyurur:)** (وَيَقُولُونَ لِلَّذٖينَ كَفَرُوا) **- yəhudilər kafir olan Məkkə əhlindən ötrü deyirlər:** (هٰۤؤُلَٓاءِ اَهْدٰى مِنَ الَّذٖينَ اٰمَنُوا سَبٖيلًا) **- Məkkə əhli Qurana iman gətirən şəxslərdən artıq hidayətdə olub yolları və dinləri onlardan haqdır.**

**52)** (اُولٰٓئِكَ الَّذٖينَ لَعَنَهُمُ اللّٰهُط وَمَنْ يَلْعَنِ اللّٰهُ فَلَنْ تَجِدَ لَهُ نَصٖيرًاۜ) - (ey Məhəmməd), **Allah-Təala onları öz rəhmətindən kənar edibdir. Allah-Təala kimi öz rəhmətindən kənar etsə, ona bir kömək edən tapa bilməzsən ki, onu əzabdan xilas etsin.**

**53)** (اَمْ لَهُمْ نَصٖيبٌ مِنَ الْمُلْكِ فَاِذًا لَا يُؤْتُونَ النَّاسَ نَقٖيرًاۙ)* (ey Məhəmməd,) **bəs yəhudilərdən ötrü dünyada bundan sonra səltənət və peyğəmbərlik və**

اَمْ يَحْسُدُونَ النَّاسَ عَلٰى مَٓا اٰتٰيهُمُ اللّٰهُ مِنْ فَضْلِهٖۚ فَقَدْ اٰتَيْنَٓا اٰلَ اِبْرٰهٖيمَ الْكِتَابَ وَالْحِكْمَةَ وَاٰتَيْنَاهُمْ
مُلْكًا عَظٖيمًا ﴿٥٤﴾ فَمِنْهُمْ مَنْ اٰمَنَ بِهٖ وَمِنْهُمْ مَنْ صَدَّ عَنْهُۜ وَكَفٰى بِجَهَنَّمَ سَعٖيرًا ﴿٥٥﴾ اِنَّ الَّذٖينَ
كَفَرُوا بِاٰيَاتِنَا سَوْفَ نُصْلٖيهِمْ نَارًاۜ كُلَّمَا نَضِجَتْ جُلُودُهُمْ بَدَّلْنَاهُمْ جُلُودًا غَيْرَهَا لِيَذُوقُوا الْعَذَابَۜ
اِنَّ اللّٰهَ كَانَ عَزٖيزًا حَكٖيمًا ﴿٥٦﴾

---

**padşahlıqdan bir hissə və pay olacaqdır? Əlbəttə, bundan sonra onlardan ötrü səltənət olmayacaqdır.** Əgər onların səltənəti olsa, dünya malından xurma çəyirdəyində olan tumurcuq qədər bir şeyi də heç kimə verməzlər.**

*(***Qeyd:** "Nəqir" xurma çəyirdəyində olan tumurcuqdur ki, ondan ağac göyərər. Ərəblər onunla misal verərlər. Qurani-Şərif də ərəb adəti üzrə nazil olubdur).*

*(****Qeyd:** Bu ayə uca peyğəmbərimizin doğruluğuna böyük dəlildir. Bu zamana kimi yəhudilər dünyaya dağılıb dövlət yarada bilməyiblər. Bir də ayə yəhudilərin xəsis olmasına dəlildir).*

**54) (اَمْ يَحْسُدُونَ النَّاسَ عَلٰى مَٓا اٰتٰيهُمُ اللّٰهُ مِنْ فَضْلِهٖۚ فَقَدْ اٰتَيْنَٓا اٰلَ اِبْرٰهٖيمَ الْكِتَابَ وَالْحِكْمَةَ وَاٰتَيْنَاهُمْ مُلْكًا عَظٖيمًا) - bəlkə yəhudilər peyğəmbərə və möminlərə həsəd edirdilər ki, Allah-Təala onlara öz lütfündən peyğəmbərlik və düşmənə qalib olmaq, günbəgün tərəqqi etmək bəxş edibdir? Niyə həsəd edirlər, halbuki bu Məhəmməddən başqa İbrahim övladı bəni-İsrailə də kitab və hikmət və böyük səltənət bəxş etmişdik.** (Yusif, Davud və Süleyman kimi şəxslər və bu peyğəmbər də Hz. İbrahimin nəslindəndir. Necə ki başqa İbrahim övladlarına səltənət və peyğəmbərlik bəxş etmişdik, Hz. Məhəmmədə də bəxş etmişik. İlk peyğəmbərlik və səltənət deyil ki, ona həsəd* edəsiniz).

*(***Qeyd:** Bu ayə yəhudilərin paxıl olduğunu bəyan edir, həsəd başqa şəxsdə olan nemətin yox olmasını istəmək deməkdir).*

**55) (فَمِنْهُمْ مَنْ اٰمَنَ بِهٖ وَمِنْهُمْ مَنْ صَدَّ عَنْهُط وَكَفٰى بِجَهَنَّمَ سَعٖيرًا) - yəhudilərdən bəzisi Hz. Məhəmmədə iman gətirib, bəzisi üz döndərdi, yanar od olan cəhənnəm iman gətirməyənlərə əzab etməkdə kifayət edər.**

**56) (اِنَّ الَّذٖينَ كَفَرُوا بِاٰيَاتِنَا)** – (ey Məhəmməd)**, həqiqətən, o şəxslər ki bizim möcüzə və ehkamlarımızı inkar edib, (سَوْفَ نُصْلٖيهِمْ نَارًا) - əlbəttə, onları cəhənnəmin oduna daxil edərik. (كُلَّمَا نَضِجَتْ جُلُودُهُمْ) – nə zaman onların dəriləri tamam yanıb bişsə, (بَدَّلْنَاهُمْ جُلُودًا غَيْرَهَا لِيَذُوقُوا الْعَذَابَ) - o yanan dərilərin əvəzində onlara başqa dərilər verərik. Ta ki əzabı həmişə dadsınlar.** (Onlardan ötrü heç vaxt ölüm olmayıb, həmişə əzabda qalacaqlar). **(اِنَّ اللّٰهَ كَانَ عَزٖيزًا حَكٖيمًا) - həqiqətən, Allah-Təala məxluqata qalibdir. Heç bir günahkar onun əzabından xilas ola bilməz. Hikmət sahibidir,** (ancaq ədalətlə) **əzab edər.**

وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَنُدْخِلُهُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَآ اَبَدًاۜ لَهُمْ
فِيهَآ اَزْوَاجٌ مُطَهَّرَةٌۘ وَنُدْخِلُهُمْ ظِلًّا ظَلِيلًا ﴿٥٧﴾ اِنَّ اللّٰهَ يَاْمُرُكُمْ اَنْ تُؤَدُّوا الْاَمَانَاتِ اِلٰٓى اَهْلِهَاۙ وَاِذَا
حَكَمْتُمْ بَيْنَ النَّاسِ اَنْ تَحْكُمُوا بِالْعَدْلِۜ

---

**57) (وَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَنُدْخِلُهُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدِينَ فِيهَآ اَبَدًا لَهُمْ فِيهَآ اَزْوَاجٌ مُطَهَّرَةٌ وَنُدْخِلُهُمْ ظِلًّا ظَلِيلًا) - əlbəttə, iman gətirib və saleh əməl edən şəxsləri ağaclarının və qəsrlərinin altından çaylar axan cənnətlərə daxil edərik. Orada həmişəlik qalıb, onlardan ötrü o cənnətlərdə hər bir eyibdən pak olan qadınlar olacaqdır. Onları həmişəlik olan elə kölgəyə daxil edərik ki, onda nə hərarət olar, nə də rütubət. (Allah-Təala heyvan təbiətli avam insanların dünyada sevdiyi şeyləri (yemək, içmək, bağ-bostan, cinsi əlaqə və s.) axirət üçün vəd etməklə onları tövhidə, maarifə və gözəl əxlaqa dəvət edir. Diqqət edilsin).**

**58) (اِنَّ اللّٰهَ يَاْمُرُكُمْ اَنْ تُؤَدُّوا الْاَمَانَاتِ اِلٰٓى اَهْلِهَاۙ) - həqiqətən, Allah-Təala sizə əmr edir ki, əmanətlərə xəyanət etməyib öz əhlinə çatdırasınız. (Bu, insanlığın ilk şərtidir). (وَاِذَا حَكَمْتُمْ بَيْنَ النَّاسِ اَنْ تَحْكُمُوا بِالْعَدْلِۜ) -** (bu hökm hakimlərə və vəzifə sahiblərinə xitabdır),*****

*(****Qeyd:** *Vay olsun o rəhbərlərə ki, bu ayəni oxuyub ona əməl etmirlər. Rüşvət almaq və tərəfdarlıq müsəlmanlar arasında şəriət kimi olub, ayənin hökmü birdəfəlik hökmsüz olubdur. Bu hökmlərə əməl etməmək islamın zəifləməsinə və zillətinə səbəbdir. Öz ümmət və məzhəb başçıları olan Hz. Əlinin (ə.s) rəftarından heç ibrət almırlar? Bir səfərdən gələndə dəvənin üstündən zirehi düşüb itmişdi. Bir nəfər yəhudi onu tapdı, o həzrət Kufə bazarında zirehi o yəhudinin əlində gördü, yəhudiyə dedi ki, bu zireh mənimdir, filan məkandan tapıbsan. Yəhudi inkar etdi. Buyurdu ki, gedək məhkəməyə. Məhkəmə üçün qazı Şüreyhin hüzuruna getdilər, (bu hadisə Hz. Əlinin xilafəti zamanında vaqe oldu. Hansı ki Şüreyhi o həzrətin özü qazı təyin etmişdi). Qazı gördü ki, əmirəl-möminin özü gəlir, hərəkət edib ayağa durmaq istədi. Həzrət ona oturması üçün işarə etdi. Həzrət gəlib yəhudiylə bir yerdə dayandı. (Məhkəmədə şərtdir ki, hər iki tərəf bir yerdə dayansınlar. Hakim üçün caiz deyildir ki, onların arasında fərq qoyub, birinə ehtiram edib, o birinə etina etməsin. Məhkəmə başlandı. Qazı o həzrətdən şahid istədi, həzrət öz qulamı Qənbəri, bir də Həsən və Hüseyni şahid göstərdi. Qazı onların şahidliyini qəbul etmədi. Həzrət dedi ki, sən Həsən və Hüseynin şahidliyini rədd edirsən? Allahın peyğəmbəri onların haqqında buyurubdur ki, Həsən və Hüseyn behişt cavanlarının ağalarıdır. Doğrudur, onlar mənim oğlumdur, amma onların şahidliyini rədd etmək olmaz. Yəhudi peşman olub iqrar etdi ki, ya əmirəl-möminin, zireh sənindir, ondan sonra islamla şərəfləndi. Həzrət buyurdu ki, o zirehi sənə bağışladım. Ondan sonra üzünü Şüreyhə tutub buyurdu: "Ey Şüreyh, əgər cavabdeh tərəf yəhudi olmasaydı, hər halda səni qətlə yetirərdim, çünki məhkəmədə mənə görə ayağa qalxdın". Heyif olsun, müsəlmanlar bu cənabın rəftarına baxmayıb, yenə də özlərini ona tabe hesab edirlər. Onların qiyamət günündə ilk düşməni elə o həzrətin özü olacaqdır. İlahi, bizə görən göz bəxş et).*

اِنَّ اللّٰهَ نِعِمَّا يَعِظُكُمْ بِهٖۜ اِنَّ اللّٰهَ كَانَ سَم۪يعًا بَص۪يرًا ﴿٥٨﴾ يَٓا اَيُّهَا الَّذ۪ينَ اٰمَنُوٓا اَط۪يعُوا اللّٰهَ وَاَط۪يعُوا الرَّسُولَ وَاُو۫لِي الْاَمْرِ مِنْكُمْۚ فَاِنْ تَنَازَعْتُمْ ف۪ي شَيْءٍ فَرُدُّوهُ اِلَى اللّٰهِ وَالرَّسُولِ اِنْ كُنْتُمْ تُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِۜ ذٰلِكَ خَيْرٌ وَاَحْسَنُ تَأْو۪يلًا ﴿٥٩﴾

---

**hökm sahibi olduğunuzda, xalqın arasında hökm verdiyiniz zaman, sizə lazım və vacibdir ki, tərəfdarlıq etməyib, rüşvət almayıb hamını hökmdə eyni cür görüb ədalət üzrə hökm edəsiniz. Allah-Təala bu hökmləri buyurub arxasınca buyurur: (اِنَّ اللّٰهَ نِعِمَّا يَعِظُكُمْ بِهٖ) - həqiqətən, Allah-Təala bu sözlərlə sizə nə gözəl öyüd-nəsihət edir. (اِنَّ اللّٰهَ كَانَ سَم۪يعًا بَص۪يرًا) - həqiqətən, Allah-Təala xalqın bütün əməllərini görüb eşidir, heç bir şey ona məxfi deyildir.** (Əvvəlki ayədə hakimlərə ədalətlə hökm etməyi buyurdu, gələn ayədə xalqa itaəti əmr edir).

**59) (يَٓا اَيُّهَا الَّذ۪ينَ اٰمَنُوٓا) - ey iman gətirən şəxslər, (اَط۪يعُوا اللّٰهَ وَاَط۪يعُوا الرَّسُولَ) - itaət edin Allah-Təalaya və itaət edin peyğəmbərə** (Hz. Məhəmmədə), **(وَاُو۫لِي الْاَمْرِ مِنْكُمْ) - bir də içinizdən olan əmr sahibi* və hakim olan şəxslərə, hansı ki haqq və ədalətlə sizinlə rəftar edirlər,**

*(***Qeyd:** əgər adil olsalar, padşahdan kətxudaya qədər, hamısına itaət etmək vacibdir, amma zalım şəxsə itaət vacib deyil, Allah-Təala zalımlardan uzaqdır, gərək zalım işdən çıxarılıb, onun yerinə adil hakimlər təyin olunsun. Əlbəttə, əgər padşaha və əmirlərə itaət edilməzsə, səltənət davam etməz. Səltənət olmayan yerdə tədricən din və məzhəb də yox olub gedər. Əgər qalsa da, yəhudilər kimi o din və məzhəbin milləti bütün millətlər arasında həqir və zəlil olar. Hz. Peyğəmbər buyurdu: "Kim mənim əmirimə və hakimimə itaət etsə, mənə itaət edibdir, (Buxari, Cihad 109; Müslüm, İmare 32-33) kim mənim əmirimə və hakimimə asi olsa, mənə asi olubdur. Amma nə qədər ki, hakim adildir, ona itaət lazımdır, elə ki ədalətdən uzaqlaşdı, ona itaət etmək lazım deyil, gərək onu dəyişdirib, adil hakim təyin etmək lazımdır. (Buxari, Ahkam 4; Müslüm, İmarə 39) II xəlifə Ömər ibn Xəttab buyurmuşdu: "Ey insanlar, nə qədər ki, ədalət üzrəyəm, mənə itaət edin, elə ki ədalətdən uzaqlaşdım, o zaman mənə itaət etmək sizə vacib deyil").*

**onlara itaət edin. (فَاِنْ تَنَازَعْتُمْ ف۪ي شَيْءٍ) - əgər siz əmir və hakimlərlə bir işdə və bir hökmdə mübahisə etsəniz, (فَرُدُّوهُ اِلَى اللّٰهِ وَالرَّسُولِ اِنْ كُنْتُمْ تُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ) - əgər qiyamət gününə iman gətiribsinizsə, o hökmü Qurani-Şərifə və peyğəmbərin hədisinə həvalə edin, Quranda və hədisdə olan hər bir hökmə əməl edin. (ذٰلِكَ خَيْرٌ وَاَحْسَنُ تَأْو۪يلًا) - o hökmü Allah-Təalaya və onun peyğəmbərinə həvalə etmək sizdən ötrü yaxşı və aqibəti xeyir olan bir işdir.** (Əgər Qurana və hədisə yönəlsəniz, o vaxt xətadan kənar olarsınız). (Mədinə əhlindən Bişr adlı bir münafiq (zahirdə müsəlman, batində kafir) **bir yəhudiylə mübahisə etdi. Yəhudi onu Hz. Peyğəmbərin hüzuruna məhkəməyə dəvət etdi. O münafiq dedi: "Yəhudilərin rəisi Kə`b ibn Əşrəfin yanına gedək". Yəhudi razı olmadı, axırda Hz. Peyğəmbərin hüzuruna gəldilər.**

اَلَمْ تَرَ اِلَى الَّذِينَ يَزْعُمُونَ اَنَّهُمْ اٰمَنُوا بِمَآ اُنْزِلَ اِلَيْكَ وَمَآ اُنْزِلَ مِنْ قَبْلِكَ يُرِيدُونَ اَنْ يَتَحَاكَمُوٓا اِلَى
الطَّاغُوتِ وَقَدْ اُمِرُوٓا اَنْ يَكْفُرُوا بِهٖ وَيُرِيدُ الشَّيْطَانُ اَنْ يُضِلَّهُمْ ضَلَالًا بَعِيدًا ﴿٦٠﴾ وَاِذَا قِيلَ لَهُمْ
تَعَالَوْا اِلٰى مَآ اَنْزَلَ اللّٰهُ وَاِلَى الرَّسُولِ رَاَيْتَ الْمُنَافِقِينَ يَصُدُّونَ عَنْكَ صُدُودًاۚ ﴿٦١﴾ فَكَيْفَ اِذَآ
اَصَابَتْهُمْ مُصِيبَةٌ بِمَاقَدَّمَتْ اَيْدِيهِمْ

---

**Hz. Peyğəmbər yəhudinin xeyrinə hökm verdi. Bişr** (münafiq) **razı olmayıb dedi: “Gəl gedək Ömər ibn Xəttabın yanına”. Ömərin hüzuruna gəldilər. Yəhudi dedi: peyğəmbər bizim aramızda hökm veribdir, bu, razı olmur. Ömər o münafiqdən soruşdu ki, belədirmi? Dedi: “Belədir”. Ömər dedi: “Gözləyin gəlirəm”. Mənzilinə daxil olub qılıncı götürüb gəldi, o münafiqin başını kəsib dedi ki, kim Allah-Təalanın və peyğəmbərin hökmünə razı olmasa, mən onun haqqında belə hökm verərəm. O vaxt bu ayə nazil oldu. Hz. Peyğəmbər Ömərə dedi: “Sən Faruqsan”** (haqla batil arasında fərq qoyansan), bundan sonra onun ləqəbi Faruq oldu).

**60)** (اَلَمْ تَرَ اِلَى الَّذِينَ يَزْعُمُونَ اَنَّهُمْ اٰمَنُوا بِمَآ اُنْزِلَ اِلَيْكَ وَمَآ اُنْزِلَ مِنْ قَبْلِكَ) **– ey Məhəmməd, guya sənə nazil olan Qurana və səndən öncəki peyğəmbərlərə nazil olan kitablara iman etdiklərini iddia edən o münafiqlərə baxmırsan?** (o münafiqlərdən biri Bişrdir), (يُرِيدُونَ اَنْ يَتَحَاكَمُوٓا اِلَى الطَّاغُوتِ) **- belə olan halda yenə istəyirlər ki, mühakimə üçün şeytana** (Kə`b ibnül-Əşrəfə) **yönəlsinlər. (Tağut şeytanın adıdır, Kə`b ibnül-Əşrəf şeytana tabe olduğundan ona tağut deyilir).** (وَقَدْ اُمِرُوٓا اَنْ يَكْفُرُوا بِهٖ) **- halbuki həqiqətən, insanlara əmr olunubdur ki, gərək şeytana inanmasınlar, nəinki tabe olsunlar.** (وَيُرِيدُ الشَّيْطَانُ اَنْ يُضِلَّهُمْ ضَلَالًا بَعِيدًا) **- şeytanın istəyi odur ki, onları haqdan son dərəcə uzaq olan zəlalətə salsın.**

**61)** (وَاِذَا قِيلَ لَهُمْ تَعَالَوْا اِلٰى مَآ اَنْزَلَ اللّٰهُ وَاِلَى الرَّسُولِ رَاَيْتَ الْمُنَافِقِينَ يَصُدُّونَ عَنْكَ صُدُودًاۚ) **-** (ey Məhəmməd), **münafiqlərə deyildiyi zaman,** (yəni sən deyəndə ki,) **Allah-Təalanın nazil etdiyi Qurana və onun peyğəmbərinə tərəf gəlin ki, sizin aranızda hökm etsin. Ey Məhəmməd, o vaxt görərsən ki, münafiqlər səndən pis bir şəkildə üz döndərirlər** (Necə ki Bişr üz döndərdi), **(bəli, ulağın şirin səsindən qaçan kimi münafiqlər də haqdan qaçarlar. Elə ki Ömər ibn Xəttab o münafiqi qətlə yetirdi, onun münafiq qohumları peyğəmbərin hüzuruna gəlib onun qanına əvəz Ömərdən intiqam alınmasını istədi, dedilər: “Ey peyğəmbər, heç vaxt sənin hökmündən çıxmarıq. Məhkəmədə başqa şəxsə müraciət etməkdə məqsədimiz islah idi”. Allah-Təala münafiqlərin bu sözünü rədd edib, münafiq Bişrin qanını hədər etdi. Necə ki sıradakı ayədə xəbər verir).**

**62)** (فَكَيْفَ اِذَآ اَصَابَتْهُمْ مُصِيبَةٌ بِمَاقَدَّمَتْ اَيْدِيهِمْ) **- öz əməllərinin səbəbinə** (peyğəmbərin hökmünə razı olmamaq səbəbinə) **onlara o müsibət** (Ömərin o münafi-

ثُمَّ جَآؤُكَ يَحْلِفُونَ بِاللّٰهِ اِنْ اَرَدْنَآ اِلَّا اِحْسَانًا وَتَوْفِيقًا ﴿٦٢﴾ اُولٰئِكَ الَّذِينَ يَعْلَمُ اللّٰهُ مَا فِي قُلُوبِهِمْ
فَاَعْرِضْ عَنْهُمْ وَعِظْهُمْ وَقُلْ لَهُمْ فِيٓ اَنْفُسِهِمْ قَوْلًا بَلِيغًا ﴿٦٣﴾ وَمَآ اَرْسَلْنَا مِنْ رَسُولٍ اِلَّا لِيُطَاعَ
بِاِذْنِ اللّٰهِ وَلَوْ اَنَّهُمْ اِذْ ظَلَمُوٓا اَنْفُسَهُمْ جَآؤُكَ فَاسْتَغْفَرُوا اللّٰهَ وَاسْتَغْفَرَ لَهُمُ الرَّسُولُ لَوَجَدُوا اللّٰهَ تَوَّابًا
رَحِيمًا ﴿٦٤﴾ فَلَا وَرَبِّكَ لَا يُؤْمِنُونَ حَتّٰى يُحَكِّمُوكَ فِيمَا شَجَرَ بَيْنَهُمْ ثُمَّ لَا يَجِدُوا فِيٓ اَنْفُسِهِمْ
حَرَجًا مِمَّا قَضَيْتَ وَيُسَلِّمُوا تَسْلِيمًا ﴿٦٥﴾

---

qi qətlə yetirməsi) **yetişdiyi zaman necə oldu münafiqlərin halı? (ثُمَّ جَآؤُكَ يَحْلِفُونَ بِاللّٰهِ اِنْ اَرَدْنَآ اِلَّا اِحْسَانًا وَتَوْفِيقًا)** – (ey Məhəmməd), **ondan sonra sənin yanına gəlib Allah-Təalaya and içib deyirlər: "Məhkəmədə səndən başqasına yönəlməklə yaxşılıq və tərəflərin arasını islah etməkdən başqa bir şey istəməmişdik".**

**63) (اُولٰئِكَ الَّذِينَ يَعْلَمُ اللّٰهُ مَا فِي قُلُوبِهِمْ) - o münafiqlər o şəxslərdir ki, Allah-Təala onların qəlblərində olan sirlərdən agahdır. Dedikləri sözlər qəlbləriylə müvafiq deyildir. (فَاَعْرِضْ عَنْهُمْ)** – (ey Məhəmməd), **onlardan üz döndərib onların sözlərinə etina etmə. (وَعِظْهُمْ) - amma onlara öyüd-nəsihət et, bəlkə, nifaqı tərk etsinlər. (وَقُلْ لَهُمْ فِيٓ اَنْفُسِهِمْ قَوْلًا بَلِيغًا) – nəsihət məqamında onların nəfslərinə təsir edib qəlblərinə qorxu salan sözlər de. Bəlkə, nifaqı tərk etsinlər.**

**64) (وَمَآ اَرْسَلْنَا مِنْ رَسُولٍ اِلَّا لِيُطَاعَ بِاِذْنِ اللّٰهِ) – biz hər bir peyğəmbəri, ancaq ona Allah-Təalanın izni və hökmüylə itaət olunsun, deyə göndərdik (ancaq Bişr kimi peyğəmbərə itaət etməyib məhkəmədə ondan başqasına yönəlib onun hökmünə razı olmayan şəxslərin münafiq olması məlum oldu). (وَلَوْ اَنَّهُمْ اِذْ ظَلَمُوٓا اَنْفُسَهُمْ)** - (ey Məhəmməd), **o zaman ki münafiqlər öz nəfslərinə zülm edib sənin hökmünə razı olmadılar, (جَآؤُكَ فَاسْتَغْفَرُوا اللّٰهَ) – gərək peşman olub sənin hüzuruna gəlib tövbə edib Allah-Təaladan bağışlanmaq istəyəydilər. (وَاسْتَغْفَرَ لَهُمُ الرَّسُولُ) - sən peyğəmbər də onların bağışlanmalarını istəsəydin, (لَوَجَدُوا اللّٰهَ تَوَّابًا رَحِيمًا) - əlbəttə, Allah-Təalanı tövbəni qəbul edib, onlara rəhm edən bilərdilər.**

**65) (فَلَا وَرَبِّكَ لَا يُؤْمِنُونَ حَتّٰى يُحَكِّمُوكَ فِيمَا شَجَرَ بَيْنَهُمْ ثُمَّ لَا يَجِدُوا فِيٓ اَنْفُسِهِمْ حَرَجًا مِمَّا قَضَيْتَ وَيُسَلِّمُوا تَسْلِيمًا)** - (ey Məhəmməd), **münafiqlər sənin hüzuruna gəlib tövbə etmədilər, and olsun, sənin rəbbinə öz aralarında olan ixtilafa səni münsif** (hakim) **təyin edib sənin hökmünə razı olmayana qədər o münafiqlərin qəlblərində iman olmaz. Hökm verəndən sonra, gərək, sənin hökmünü zahirdə və batində qəbul edib itaət etsinlər. O vaxt məlum olar ki, onlarda iman var imiş.**

**66) (وَلَوْ اَنَّا كَتَبْنَا عَلَيْهِمْ اَنِ اقْتُلُوٓا اَنْفُسَكُمْ اَوِ اخْرُجُوا مِنْ دِيَارِكُمْ)** - (ey Məhəmməd), **əgər həqiqətən, biz münafiqlərə yazıb əmr etsəydik ki, gərək siz münafiqlər**

وَلَوْ اَنَّا كَتَبْنَا عَلَيْهِمْ اَنِ اقْتُلُوٓا اَنْفُسَكُمْ اَوِ اخْرُجُوا مِنْ دِيَارِكُمْ مَا فَعَلُوهُ اِلَّا قَلِيلٌ مِنْهُمْ ؕ وَلَوْ اَنَّهُمْ
فَعَلُوا مَا يُوعَظُونَ بِهٖ لَكَانَ خَيْرًا لَهُمْ وَاَشَدَّ تَثْبِيتًاۙ ﴿٦٦﴾ وَاِذًا لَاٰتَيْنَاهُمْ مِنْ لَدُنَّآ اَجْرًا عَظِيمًاۙ ﴿٦٧﴾
وَلَهَدَيْنَاهُمْ صِرَاطًا مُسْتَقِيمًا ﴿٦٨﴾ وَمَنْ يُطِعِ اللّٰهَ وَالرَّسُولَ فَاُولٰٓئِكَ مَعَ الَّذِينَ اَنْعَمَ اللّٰهُ عَلَيْهِمْ مِنَ
النَّبِيّنَ وَالصِّدّيقِينَ وَالشُّهَدَآءِ وَالصَّالِحِينَ ۚ وَحَسُنَ اُولٰٓئِكَ رَفِيقًا ﴿٦٩﴾ ذٰلِكَ الْفَضْلُ مِنَ اللّٰهِ وَكَفٰى
بِاللّٰهِ عَلِيمًا ﴿٧٠﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا خُذُوا حِذْرَكُمْ فَانْفِرُوا ثُبَاتٍ اَوِ انْفِرُوا جَمِيعًا ﴿٧١﴾

---

**bir-birinizi** (peyğəmbərə itaət edənlər etməyənləri) **qətlə yetirin,** (Necə ki bəni-İsrailə buzova sitayiş edəndən sonra əmr etdik)**, ya da əmr etsəydik onlara ki, ev və yurdunuzdan çıxıb köçün, (Necə ki bəni-İsrailə əmr etdik, Misirdən çıxdılar, görək bəni-İsrail kimi itaət edirlər, yoxsa yox?) (مَا فَعَلُوهُ) (اِلَّا قَلِيلٌ مِنْهُمْ) - bu hökmə onların ancaq az bir qismi istisna olmaqla itaət edib əməl etməzlər. (وَلَوْ اَنَّهُمْ فَعَلُوا مَا يُوعَظُونَ بِهٖ) - əgər onlar öyüd-nəsihət edilən sözlərə əməl etsələr,** (peyğəmbərə tabe olub onun hökmünə itaət etsələr), **(لَكَانَ خَيْرًا لَهُمْ وَاَشَدَّ تَثْبِيتًاۙ) - hər halda bu itaət onlardan ötrü yaxşı və imanları üçün sabit və möhkəm olardı.**

**67-68) (وَاِذًا لَاٰتَيْنَاهُمْ مِنْ لَدُنَّآ اَجْرًا عَظِيمًاۙ وَلَهَدَيْنَاهُمْ صِرَاطًا مُسْتَقِيمًا) - əgər onlar imanlarında sabit olub peyğəmbərə itaət etsələr, o vaxt onlara öz yanımızdan,** (təfəddülən bi duni istihaq) **- böyük savab verərik. Əlbəttə, onları düz olan yola** (nicat yoluna) **hidayət edərik.**

**69) (وَمَنْ يُطِعِ اللّٰهَ وَالرَّسُولَ) - kim Allah-Təalaya və onun peyğəmbərinə** (Hz. Məhəmmədə ə.s) **itaət etsə, (فَاُولٰٓئِكَ مَعَ الَّذِينَ اَنْعَمَ اللّٰهُ عَلَيْهِمْ) - o itaət edənlər axirətdə Allah-Təalanın bol nemət verdiyi şəxslərlə bir yerdə olacaqlar, (مِنَ النَّبِيّنَ وَالصِّدّيقِينَ وَالشُّهَدَآءِ وَالصَّالِحِينَ) – bol nemət verilən şəxslər peyğəmbərlər, hamıdan əvvəl peyğəmbərləri təsdiq edənlər və Allah-Təala yolunda cihad edib şəhid olanlar, bir də təqva sahibi olanlardır, Allah-Təalaya və peyğəmbərə itaət edən şəxs belə şəxslərlə bir yerdə olacaqdır. (وَحَسُنَ اُولٰٓئِكَ رَفِيقًا) – qeyd olunan şəxslər nə gözəl yoldaşdırlar.**

**70) (ذٰلِكَ الْفَضْلُ مِنَ اللّٰهِ وَكَفٰى بِاللّٰهِ عَلِيمًا) - bu zikr olunan şəxslərlə yoldaş olmaq Allah-Təaladan lütf və bəxşişdir. Allah-Təala bəndələrinin halına agah olmaqda kifayət edər.**

**71) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا)- ey iman gətirən şəxslər, (خُذُوا حِذْرَكُمْ) - həmişə düşməndən ehtiyatda olub savaş tədarükünüz hazır olsun ki, düşmən qəfildən üstünüzə gəlib sizə qalib olmasın. (فَانْفِرُوا ثُبَاتٍ) - savaşa gedən vaxt dəstə-dəstə gedin. (اَوِ انْفِرُوا جَمِيعًا) – ya da sizdən bir nəfər də geridə qalmayıb, birlikdə savaşa gedin.** (Savaşa dəstə-dəstə getməyin faydası odur ki, düşmən sizin dalbadal gələn dəstələrinizi görəndə sizdən qorxar. Birlikdə getməyin faydası odur ki, düşmən birlik içində olmanızdan qorxar).

وَاِنَّ مِنْكُمْ لَمَنْ لَيُبَطِّئَنَّۚ فَاِنْ اَصَابَتْكُمْ مُصِيبَةٌ قَالَ قَدْ اَنْعَمَ اللّٰهُ عَلَيَّ اِذْ لَمْ اَكُنْ مَعَهُمْ شَهِيدًا ﴿٧٢﴾
وَلَئِنْ اَصَابَكُمْ فَضْلٌ مِنَ اللّٰهِ لَيَقُولَنَّ كَاَنْ لَمْ تَكُنْ بَيْنَكُمْ وَبَيْنَهُ مَوَدَّةٌ يَا لَيْتَنِي كُنْتُ مَعَهُمْ فَاَفُوزَ فَوْزًا
عَظِيمًا ﴿٧٣﴾ فَلْيُقَاتِلْ فِي سَبِيلِ اللّٰهِ الَّذِينَ يَشْرُونَ الْحَيٰوةَ الدُّنْيَا بِالْاٰخِرَةِ وَمَنْ يُقَاتِلْ فِي سَبِيلِ اللّٰهِ
فَيُقْتَلْ اَوْ يَغْلِبْ فَسَوْفَ نُؤْتِيهِ اَجْرًا عَظِيمًا ﴿٧٤﴾

---

**72) (وَاِنَّ مِنْكُمْ لَمَنْ لَيُبَطِّئَنَّ) - həqiqətən, sizdən bəzi münafiqlər** (Abdullah ibn Übey və onun yoldaşları) **vardır ki, cihada gedəndə ağır tərpənib geridə qalarlar. (فَاِنْ اَصَابَتْكُمْ مُصِيبَةٌ) - ey möminlər, əgər cihad etməkdə sizə bir müsibət yetişib düşmən sizə qalib olsa, (قَالَ قَدْ اَنْعَمَ اللّٰهُ عَلَيَّ) - o münafiq şad olub deyər: "Həqiqətən, Allah-Təala mənə nemət verib, (اِذْ لَمْ اَكُنْ مَعَهُمْ شَهِيدًا) - çünki mən savaşda onlarla bir yerdə olmadım. Yoxsa onlara yetişən müsibətdən mənə də yetişərdi".**

**73) (وَلَئِنْ اَصَابَكُمْ فَضْلٌ مِنَ اللّٰهِ لَيَقُولَنَّ كَاَنْ لَمْ تَكُنْ بَيْنَكُمْ وَبَيْنَهُ مَوَدَّةٌ يَا لَيْتَنِي كُنْتُ مَعَهُمْ فَاَفُوزَ فَوْزًا عَظِيمًا) - amma əgər cihad etməkdə Allah-Təaladan sizə bir lütf gəlib, düşmənə qalib olub qənimət əldə etsəniz, əlbəttə, o münafiq guya sizinlə onun arasında heç bir dostluq olmamış kimi deyər ki, kaş cihad etməkdə sizə kömək edəydi, halbuki həmişə sizə dostluğunu izhar edibdir. Deyər ki, gərək geri qalmayaydım, kaş mən də onlarla bir yerdə savaşda olub böyük qənimət əldə edəydim.**

**74) (فَلْيُقَاتِلْ فِي سَبِيلِ اللّٰهِ الَّذِينَ يَشْرُونَ الْحَيٰوةَ الدُّنْيَا بِالْاٰخِرَةِ)- dünya həyatını axirətə üstün sayıb, cihadı tərk edən şəxslər gərək etiqadlarını dəyişdirib, axirəti dünyaya üstün sayıb, nifaqı tərk edib imanlarını saf edib Allah-Təala yolunda cihad etsinlər. (وَمَنْ يُقَاتِلْ فِي سَبِيلِ اللّٰهِ) - kim Allah-Təala yolunda cihad etsə, (فَيُقْتَلْ اَوْ يَغْلِبْ) – öldürülsə, ya da düşmənə qalib olsa, (فَسَوْفَ نُؤْتِيهِ اَجْرًا عَظِيمًا) - hər iki halda da əlbəttə, ona böyük əcr və savab bəxş edərik.** (Hz. Peyğəmbər Məkkədən Mədinəyə hicrət edəndən sonra Məkkədə qalan müsəlmanlardan zəif olanların, qadınların, uşaqların həm hicrət etməyə gücü olmadı, bir tərəfdən də müşriklər onlara mane olub əziyyət edirdilər. Məkkədə son dərəcə zillət içində qalıb heç bir çarə tapmayıb, dua edərək dualarında belə deyirdilər: "Allahım, bizi bu zalım şəxslərdən xilas et" (Nəsai, Cihad 1). Sıradakı ayə onların haqqında nazil oldu, Allah-Təala ayədə müsəlmanları cihad edib Məkkədə olan müsəlmanları müşriklərin şərindən xilas etməyi əmr edir. Ondan sonra Allah-Təala Hz. Peyğəmbərə güc verdi, islam dini qüvvətləndi, gəlib Məkkəni fəth edib o müsəlmanları müşriklərin şərindən və əziyyətindən xilas etdi).

**75) (وَمَا لَكُمْ لَا تُقَاتِلُونَ فِي سَبِيلِ اللّٰهِ) - ey möminlər, sizə nə mane olur ki, Allah-Təala yolunda müşriklərlə cihad etmirsiniz? (وَالْمُسْتَضْعَفِينَ مِنَ الرِّجَالِ وَالنِّسَاءِ وَالْوِلْدَانِ) - cihad etmirsiniz ki, zəif olan şəxsləri - kişi, qadın və uşaq-**

وَمَا لَكُمْ لَا تُقَاتِلُونَ فِي سَبِيلِ اللّٰهِ وَالْمُسْتَضْعَفِينَ مِنَ الرِّجَالِ وَالنِّسَٓاءِ وَالْوِلْدَانِ الَّذِينَ يَقُولُونَ رَبَّنَٓا
اَخْرِجْنَا مِنْ هٰذِهِ الْقَرْيَةِ الظَّالِمِ اَهْلُهَاۚ وَاجْعَلْ لَنَا مِنْ لَدُنْكَ وَلِيًّاۚ وَاجْعَلْ لَنَا مِنْ لَدُنْكَ نَصِيرًاۜ ﴿٧٥﴾
اَلَّذِينَ اٰمَنُوا يُقَاتِلُونَ فِي سَبِيلِ اللّٰهِۚ وَالَّذِينَ كَفَرُوا يُقَاتِلُونَ فِي سَبِيلِ الطَّاغُوتِ فَقَاتِلُوٓا اَوْلِيَٓاءَ الشَّيْطَانِۚ
اِنَّ كَيْدَ الشَّيْطَانِ كَانَ ضَعِيفًاۚ ﴿٧٦﴾ اَلَمْ تَرَ اِلَى الَّذِينَ قِيلَ لَهُمْ كُفُّوٓا اَيْدِيَكُمْ وَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا
الزَّكٰوةَۚ فَلَمَّا كُتِبَ عَلَيْهِمُ الْقِتَالُ

---

**ları müşriklərin əziyyətindən xilas edəsiniz? (الَّذِينَ يَقُولُونَ رَبَّنَٓا اَخْرِجْنَا مِنْ هٰذِهِ الْقَرْيَةِ الظَّالِمِ اَهْلُهَاۚ) – halbuki onlar heç bir çarə tapmayıb dua edib dualarında belə deyirlər: "Ey bizim rəbbimiz, bizi əhalisi zalım olan bu Məkkə şəhərindən çıxarıb xilas et. (وَاجْعَلْ لَنَا مِنْ لَدُنْكَ وَلِيًّا) – bizə öz yanından bir şəxs təyin et ki, bizim işlərimizi idarə etsin. (وَاجْعَلْ لَنَا مِنْ لَدُنْكَ نَصِيرًا) - yenə bizə öz yanından bir şəxs təyin et ki, bizə kömək olub bizi bu Məkkə əhlinin zülmündən xilas etsin".** (Allah-Təala onların duasını qəbul edib, uca peyğəmbərimiz Hz. Məhəmmədi (ə.s) onlara köməkçi təyin edib, o zəifləri müşriklərin əziyyətindən xilas etdi).

**76) (اَلَّذِينَ اٰمَنُوا يُقَاتِلُونَ فِي سَبِيلِ اللّٰهِۚ) - o şəxslər ki Allah-Təalaya iman gətiriblər, onlar Allah-Təala yolunda cihad edərlər, (وَالَّذِينَ كَفَرُوا يُقَاتِلُونَ فِي سَبِيلِ الطَّاغُوتِ) - amma Allah-Təalanı inkar edən şəxslər şeytanın yolunda savaşarlar. (فَقَاتِلُوٓا اَوْلِيَٓاءَ الشَّيْطَانِۚ) - ey möminlər, siz şeytanın dostları olan müşriklərlə cihad edin, sizə kömək olan Allah-Təaladır, onlarınkı isə şeytandır. (اِنَّ كَيْدَ الشَّيْطَانِ كَانَ ضَعِيفًاۚ) - həqiqətən, şeytanın məkr və hiyləsi Allah-Təalanın yanında zəifdir. Heç vaxt şeytanın dostları sizə qalib ola bilməzlər. (Hz. Peyğəmbər Məkkədə olanda səhabələrdən bəzisi dedilər: "Ey Peyğəmbər, bizə izin ver, bu müşriklərlə cihad edək". Hz. Peyğəmbər onlara izin vermədi. Onlara namaz qılıb zəkat verməyi əmr etdi. Mədinəyə hicrət edəndən sonra cihad etməklə əmr olunduqlarında isə cihadın təxirə salınmasını xahiş etdilər. O zaman bu ayə nazil oldu).**

**77) (اَلَمْ تَرَ اِلَى الَّذِينَ قِيلَ لَهُمْ كُفُّوٓا اَيْدِيَكُمْ)** – (ey Məhəmməd), **bəs o şəxslərə baxmırsan ki, Məkkədə olan zaman onlara belə deyilmişdi,** (sən onlara dedin ki,) **müşriklərlə cihad etməkdən əllərinizi saxlayın, hələ cihad vaxtı yetişməyibdir. (وَاَقِيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ) - namaz qılıb zəkat verin, bu halda siz o iki əmri yerinə yetirin, bundan sonra cihada hökm olunacaqdır.** (Onlar o vaxt cihad etməyi arzu edirdilər). **(فَلَمَّا كُتِبَ عَلَيْهِمُ الْقِتَالُ) – o zaman ki** (Mədinəyə hicrət edəndən sonra) **onlara cihad etmək yazılıb vacib oldu, (اِذَا فَرِيقٌ مِنْهُمْ يَخْشَوْنَ النَّاسَ كَخَشْيَةِ اللّٰهِ اَوْ اَشَدَّ خَشْيَةً)** – (ey Məhəmməd), **müsəlmanlardan bir qrupu dərhal görərsən ki, Allah-Təaladan qorxan kimi, bəlkə. ondan da artıq müşriklərdən qorxarlar. (وَقَالُوا رَبَّنَا لِمَ كَتَبْتَ عَلَيْنَا**

اِذَا فَرِيقٌ مِنْهُمْ يَخْشَوْنَ النَّاسَ كَخَشْيَةِ اللّٰهِ اَوْ اَشَدَّ خَشْيَةً ۚ وَقَالُوا رَبَّنَا لِمَ كَتَبْتَ عَلَيْنَا الْقِتَالَ ۚ لَوْلَٓا اَخَّرْتَنَٓا اِلٰٓى اَجَلٍ قَرِيبٍ ۜ قُلْ مَتَاعُ الدُّنْيَا قَلِيلٌ ۚ وَالْاٰخِرَةُ خَيْرٌ لِمَنِ اتَّقٰى وَلَا تُظْلَمُونَ فَتِيلًا ﴿٧٧﴾ اَيْنَ مَا تَكُونُوا يُدْرِكْكُمُ الْمَوْتُ وَلَوْ كُنْتُمْ فِي بُرُوجٍ مُشَيَّدَةٍ وَاِنْ تُصِبْهُمْ حَسَنَةٌ يَقُولُوا هٰذِهِ مِنْ عِنْدِ اللّٰهِ ۚ

---

(الْقِتَالَ ۚ لَوْلَٓا اَخَّرْتَنَٓا اِلٰٓى اَجَلٍ قَرِيبٍ) **- qorxmaqdan əlavə həm də dedilər: "Ey bizim rəbbimiz, niyə cihadı bizə belə tez vacib etdin, nə olardı ki, cihadın vaxtını bir qədər təxirə salaydın?"** (قُلْ مَتَاعُ الدُّنْيَا قَلِيلٌ وَالْاٰخِرَةُ خَيْرٌ لِمَنِ اتَّقٰى) - (ey Məhəmməd)**, onlara de ki, siz dünyanı arzu edirsiniz, dünyanın malı az və fani olan şeydir. Cihad etməkdə isə axirət neməti vardır. Müttəqilərdən ötrü axirət yaxşı və əbədidir. Belə sözləri tərk edib cihada gedin.** (وَلَا تُظْلَمُونَ فَتِيلًا) **- xurmanın çəyirdəyində olan tel qədər sizə zülm olunmayıb və heç vaxt da əcr və savabınız əskik olmaz. Əlbəttə, cihad* etməkdə süst olmayıb, cihada həvəslə gedin.**

*(****Qeyd:*** *Hərçənd cihad etməkdə ölüm vardır, amma ölüm din və ümmətin tərəqqisinə səbəbdir. Dindar və ümmətini sevən şəxs din və ümmət yolunda canından keçməyi, gərək, böyük səadət hesab etsin, necə ki islamın ilk dövrlərindəki şəxslər əgər can və mallarını islam yolunda qurban etməsəydilər, islam dini dünyada bu qədər yayılmazdı. Cihad etmək təkcə savaşıb canı qurban etmək deyildir. Cihad dil və mal ilə də olar. Hətta elə cihad var ki, mal ilə olar, candan keçməklə olmaz, xüsusən, bu zamanda Allah-Təala yolunda cihad etmək maldan keçməklə mümkündür. Varlı şəxs malından keçib ümmətin övladlarını cəhalət və zəlalətdən xilas etsə, Allah-Təala yolunda ilk mücahidlərdən hesab olunar. Bu dövr vurub kəsmək, zor və qüvvət zamanı deyil, bu günün qılıncı və bəzəyi elmdir. Bu dövrdə din və ümmətin tərəqqisi elmlə mümkündür. Hansı millət cəhaləti dəf edib elmə sahib olsa, tərəqqi və üstünlük onlarda müşahidə olunar. Bugünkü gündə islam ümmətini fəlakətə və rəzalətə salan şey cəhalətdir. Cəhalətin səbəbi iki şeydir: birincisi - əksər ruhanilərimizin şəxsi məqsədləri üçün çalışması, ikincisi – varlılarımızın xəsisliyi. Bunlar var-dövlətlərini ümmətin övladları yolunda xərcləməyib, müsəlmanların elm və mədəniyyətə yönəlməsinə mane olub, elmi təkcə axirət elminə aid sayıb, onların mədəniyyət aləminə daxil olmalarına mane olurlar. Allah-Təala hər iki qrupa hidayət etsin. Müsəlman olan şəxs gərək hər dövrün şərtinə görə cihad edib, müqəddəs islam dinini yaymaq fikrində olsun).*

**78)** (اَيْنَ مَا تَكُونُوا يُدْرِكْكُمُ الْمَوْتُ) **- harda olsanız, ölüm sizə gələcəkdir,** (وَلَوْ كُنْتُمْ فِي بُرُوجٍ مُشَيَّدَةٍ) **– hətta uca və möhkəm qalalarda olsanız da,** (cihadda, ya da başqa vaxt insan hökmən öləcəkdir, cihaddan qaçmaq insanı ölümdən qorumaz. Bəlkə, insana xəcalət gətirər, ən yaxşı ölüm din və ümmət yolunda ölməkdir). (وَاِنْ تُصِبْهُمْ حَسَنَةٌ يَقُولُوا هٰذِهِ مِنْ عِنْدِ اللّٰهِ) – (ey Məhəmməd), **əgər bu münafiqlərə bol dünya neməti və firavanlıq yetişsə, o vaxt deyərlər: "Bu nemət Allah-Təala tərəfindən bizə yetişir".** (وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ يَقُولُوا هٰذِهِ مِنْ عِنْدِكَ) **- əgər onlara qəhətlik və yoxsulluq bəlası yetişsə, o vaxt da** (ey Məhəmməd), **sənə deyərlər ki, bu bəla səndən və sənin bədliyindən bizə yetişir.** (قُلْ كُلٌّ

وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ يَقُولُوا هٰذِهٖ مِنْ عِنْدِكَ ۜ قُلْ كُلٌّ مِنْ عِنْدِ اللّٰهِ فَمَا لِ هٰؤُلَٓاءِ الْقَوْمِ لَا يَكَادُونَ يَفْقَهُونَ
حَدٖيثًا ﴿٧٨﴾ مَٓا اَصَابَكَ مِنْ حَسَنَةٍ فَمِنَ اللّٰهِ وَمَٓا اَصَابَكَ مِنْ سَيِّئَةٍ فَمِنْ نَفْسِكَ ۜ وَاَرْسَلْنَاكَ لِلنَّاسِ
رَسُولًا وَكَفٰى بِاللّٰهِ شَهٖيدًا ﴿٧٩﴾ مَنْ يُطِعِ الرَّسُولَ فَقَدْ اَطَاعَ اللّٰهَ وَمَنْ تَوَلّٰى فَمَٓا اَرْسَلْنَاكَ عَلَيْهِمْ
حَفٖيظًا ﴿٨٠﴾ وَيَقُولُونَ طَاعَةٌ

---

**(مِنْ عِنْدِ اللّٰهِ) –** (ey Məhəmməd), **onlara de ki, nemət və bəlanın hamısı Allah-Təaladandır. Bəzən nemət verər, bəzən bəla, hər birinin bir səbəbi vardır.** (Bundan sonra gələn ayədə o səbəb bəyan olunur). **(فَمَا لِ هٰؤُلَٓاءِ الْقَوْمِ لَا يَكَادُونَ يَفْقَهُونَ حَدٖيثًا) - nə olubdur o münafiqlərə ki, heç anlamırlar ki, nemət və bəlanın hamısı Allah-Təala tərəfindəndir?**

**79) (مَٓا اَصَابَكَ مِنْ حَسَنَةٍ فَمِنَ اللّٰهِ) –** (ey insan), **sənə yetişən hər bir nemət və ehsan Allah-Təaladan bir lütf və mərhəmətdir. O nemətin sənə yetişməsində sənin heç bir haqqın yoxdur. (وَمَٓا اَصَابَكَ مِنْ سَيِّئَةٍ فَمِنْ نَفْسِكَ) - amma ey insan, sənə yetişən hər bir bəla və müsibətin səbəbi sənin özünün qəbih əməllərindir. Həmin qəbih əməllər Allah-Təalanın səndən öz nemətini əsirgəyib, bəla yetirməsinə səbəb olar. (وَاَرْسَلْنَاكَ لِلنَّاسِ رَسُولًا وَكَفٰى بِاللّٰهِ شَهٖيدًا) –** (ey Məhəmməd),*** biz səni Adəm övladı olan bütün insanlara peyğəmbər göndərmişik. (Sadəcə ərəblərə peyğəmbər deyilsən, bütün ərəblərin, əcəmin, dünya üzündə olan bütün məxluqatın peyğəmbərisən, sən münafiqlərin sözlərinə baxmayıb Allah-Təala ehkamını xalqa çatdır). Allah-Təalanın sənin bütün insanlara peyğəmbər olmağın haqda şəhadəti kifayət edər.**

*(**Qeyd:** Peyğəmbərlərdən ancaq iki nəfər bütün insanlığa göndərilibdir, biri bizim uca peyğəmbərimizdir, necə ki bu ayədə Allah-Təala xəbər verdi, o biri də Hz. Peyğəmbərin əcdadı cənab Hz. İbrahimdır. Necə ki Bəqərə surəsinin 125-ci ayəsində qeyd olundu. Bu iki peyğəmbərdən başqa qalan bütün peyğəmbərlərin hər biri öz qövmlərinə göndəriliblər).*

**80) (مَنْ يُطِعِ الرَّسُولَ فَقَدْ اَطَاعَ اللّٰهَ)- kim bu peyğəmbərə** (Hz. Məhəmmədə) **itaət etsə, həqiqətən, o şəxs Allah-Təalaya itaət edibdir. (وَمَنْ تَوَلّٰى فَمَٓا اَرْسَلْنَاكَ عَلَيْهِمْ حَفٖيظًا) -** (ey Məhəmməd), **kim sənə arxasını çevirib itaət etməsə, sən də ona arxanı çevirib onu bizə həvalə et. Biz səni xalqın əməllərinə nəzarət edib onların haqq-hesabına baxan və əzab edən göndərməmişik.**

**81) (وَيَقُولُونَ طَاعَةٌ) -** (ey Məhəmməd), **nə zaman münafiqlərə bir şeyi əmr etsən, sənin hüzurunda deyərlər ki, sənin hər bir əmrinə itaət edərik. (فَاِذَا بَرَزُوا مِنْ عِنْدِكَ بَيَّتَ طَٓائِفَةٌ مِنْهُمْ غَيْرَ الَّذٖي تَقُولُ) – nə zaman sənin yanından çıxsalar, o münafiqlərdən bir qrup gecə vaxtı bir yerə yığılıb, sənin əmrinin tərsini edərlər. (وَاللّٰهُ يَكْتُبُ مَا يُبَيِّتُونَ) - amma ondan qafildirlər ki, Allah-Təala on-**

فَاِذَا بَرَزُوا مِنْ عِنْدِكَ بَيَّتَ طَٓائِفَةٌ مِنْهُمْ غَيْرَ الَّذ۪ي تَقُولُۜ وَاللّٰهُ يَكْتُبُ مَا يُبَيِّتُونَۚ فَاَعْرِضْ عَنْهُمْ وَتَوَكَّلْ عَلَى اللّٰهِۜ وَكَفٰى بِاللّٰهِ وَك۪يلًا ﴿٨١﴾ اَفَلَا يَتَدَبَّرُونَ الْقُرْاٰنَۜ وَلَوْ كَانَ مِنْ عِنْدِ غَيْرِ اللّٰهِ لَوَجَدُوا ف۪يهِ اخْتِلَافًا كَث۪يرًا ﴿٨٢﴾ وَاِذَا جَٓاءَهُمْ اَمْرٌ مِنَ الْاَمْنِ اَوِ الْخَوْفِ اَذَاعُوا بِه۪

---

**ların dəyişdirdiklərini yazıb, mühafizə edib, o əməllərin cəzasını onlara yetirəcəkdir.* (فَاَعْرِضْ عَنْهُمْ وَتَوَكَّلْ عَلَى اللّٰهِ) -** (ey Məhəmməd)**, sən də onlardan üz döndər, elə olmasın ki, onlardan intiqam almaq istəyəsən, Allah-Təalaya təvəkkül et. (وَكَفٰى بِاللّٰهِ وَك۪يلًا) - Allah-Təalanın sənə vəkil olması kifayət edər.**

*(****Qeyd:*** *O şəxslər ki islama tənə edib deyirlər: "İslam dininin təməli savaş və qətllə qoyulub," bir bu ayəyə baxsınlar ki, Allah-Təala öz peyğəmbərinə düşmənləriylə necə rəftar edib sülh içində olmağı əmr edir. Bəli, islam tarixində olan cihadları inkar etmək olmaz, amma peyğəmbər heç vaxt səbəbsiz yerə bir tayfanın üstünə ordu göndərib onları qətl və qarət etməyib. Hz. Peyğəmbərin bütün savaşları məlumdur, bütün savaşlarının səbəbkarı düşmənləri olubdur, ağıl sahibləri diqqət etsinlər).*

**82) (اَفَلَا يَتَدَبَّرُونَ الْقُرْاٰنَ) - o şəxslər ki Quranı inkar edib qəbul etmirlər, bəs Qurani-Şərifin açıq-aşkar ayələrini düşünmürlər? (وَلَوْ كَانَ مِنْ عِنْدِ غَيْرِ اللّٰهِ لَوَجَدُوا ف۪يهِ اخْتِلَافًا كَث۪يرًا) - əgər** Quran Allah-Təaladan başqasının yanından olsaydı, hər halda onda çox ixtilaf tapardılar.** (Mədinədə olan bəzi müsəlmanlar ağıllı və tədbirli deyildilər, Hz. Peyğəmbərin cihada gedən ordusundan (qalib, ya da məğlub olması haqda) onlara bir xəbər gələn kimi, o xəbəri qoruya bilməyib, aşkar edirdilər. Münafiqlər ondan xəbərdar olub fəsad törədirdilər. Gələn ayədə Allah-Təala onları xəbərdar edir ki, sirlərinizi münafiqlərə bildirməyin).

*(*****Qeyd:*** *Qurani-Şərifin bütün kəlmələri möcüzədir. Heç kim onun bir kəlməsinin müqabilində bir kəlmə gətirməyə qadir deyildir. Bir insan ərəb dilində və bəlağət elmində kamil elm sahibi olmazsa, Quranın həqiqətini və necə ali bir kəlam olduğunu dərk edə bilməz, adını alim qoyan hər kəs Quranın həqiqətini dərk edə bilməz. Bununla belə ərəb dilinin kəlmələrinə və qayda-qanunlarına bələd olub, bəzi bidətlərlə zehni bulanmayan şəxslər üçün vacib ehkamları təbliğ etməkdə və müstəqil şəkildə hidayət yolunu göstərməkdə Qurani-Şərifin dəlil olması aydın və aşkardır. Bizim zəmanəmizdə əksər elm əhlinin zehinləri bəzi uydurmalarla bulandığı üçün müsəlmanlar arasında ixtilaf meydana gəlibdir).*

**83) (وَاِذَا جَٓاءَهُمْ اَمْرٌ مِنَ الْاَمْنِ اَوِ الْخَوْفِ اَذَاعُوا بِه۪) – nə zaman ağıllı və tədbirli olmayan müsəlmanlara Hz. Peyğəmbərin qalib və ya məğlub olmaq xəbəri yetişsə, o xəbəri saxlaya bilməyib münafiqlərə aşkar edərlər. (وَلَوْ رَدُّوهُ اِلَى الرَّسُولِ وَاِلٰٓى اُو۬لِي الْاَمْرِ مِنْهُمْ لَعَلِمَهُ الَّذ۪ينَ يَسْتَنْبِطُونَهُ مِنْهُمْ) - əgər* o xəbəri yaymayıb, gəlib peyğəmbərə və ya səhabələrdən rəy və tədbir sahibi olan əmirlərə, savaş işlərinə agah olan şəxslərə xəbər versəydilər, onlar o xəbərə agah olub öz ağıl və fərasətləriylə o xəbərin tədbirini bilib, onun**

وَلَوْ رَدُّوهُ اِلَى الرَّسُولِ وَاِلٰٓى اُولِي الْاَمْرِ مِنْهُمْ لَعَلِمَهُ الَّذ۪ينَ يَسْتَنْبِطُونَهُ مِنْهُمْ ۜ وَلَوْلَا فَضْلُ اللّٰهِ
عَلَيْكُمْ وَرَحْمَتُهُ لَاتَّبَعْتُمُ الشَّيْطَانَ اِلَّا قَل۪يلًا ﴿٨٣﴾ فَقَاتِلْ ف۪ي سَب۪يلِ اللّٰهِۚ لَا تُكَلَّفُ اِلَّا نَفْسَكَ
وَحَرِّضِ الْمُؤْمِن۪ينَۚ عَسَى اللّٰهُ اَنْ يَكُفَّ بَأْسَ الَّذ۪ينَ كَفَرُواۜ وَاللّٰهُ اَشَدُّ بَأْسًا وَاَشَدُّ تَنْك۪يلًا ﴿٨٤﴾ مَنْ
يَشْفَعْ شَفَاعَةً حَسَنَةً يَكُنْ لَهُ نَص۪يبٌ مِنْهَاۚ وَمَنْ يَشْفَعْ شَفَاعَةً سَيِّئَةً يَكُنْ لَهُ كِفْلٌ مِنْهَاۜ

---

**çarəsini tapa bilərdilər.** (Əlbəttə, münafiq şəxsə heç bir xəbəri izhar etmək olmaz). **(وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكُمْ وَرَحْمَتُهُ لَاتَّبَعْتُمُ الشَّيْطَانَ اِلَّا قَل۪يلًا) - əgər Allah-Təalanın siz zəif tədbirli şəxslərə yardımı olmasaydı, hər halda şeytana tabe olub küfr və zəlalətdə qalardınız. Ancaq az bir qisminiz nicat tapardı.** (Əbu Süfyan Qüreyş əhlini Məkkədə toplayıb, ikinci dəfə Bədirdə Hz. Peyğəmbərlə savaşa gəldi, buna kiçik Bədir savaşı deyilir. Hz. Peyğəmbər Mədinə əhlinə cihada getməyi əmr etdi. İnsanların bəzisi cihada getmək istəmədi, o vaxt da bu ayə nazil oldu).

*(*****Qeyd:** Ağıl sahibləri bu ayəyə baxsınlar ki, Allah-Təala necə ümummilli sirləri mühafizə edib rəy və tədbir sahibi olan şəxslərə tapşırmağı əmr edir. İndiki dövrdə başqa millətlərin həmin hökmə cani-dildən əməl edib, Quran əhlinin cəhalət səbəbi ilə bundan məhrum qalması təəssüf ediləcək bir haldır).*

**84) (فَقَاتِلْ ف۪ي سَب۪يلِ اللّٰهِۚ)** – (ey Məhəmməd), **cihada gedib, Allah-Təala yolunda cihad et. Hətta səni tək qoyub heç bir nəfər sənə kömək olmasa da. (لَا تُكَلَّفُ اِلَّا نَفْسَكَ) – sən sadəcə özünə cavabdehsən, hərçənd tək qalsan da gərək cihada gedəsən, sənə kömək Allah-Təaladır. (وَحَرِّضِ الْمُؤْمِن۪ينَ) - amma möminləri də yaxşı sözlərlə cihada getməyə həvəsləndir. Nəinki zorla onları cihada apar. (عَسَى اللّٰهُ اَنْ يَكُفَّ بَأْسَ الَّذ۪ينَ كَفَرُواۜ) - ümidvar ol ki, Allah-Təala sizə qarşı kafir şəxslərin** (Qüreyşin) **hücumunu və şücaətini qırar, heç bir zərər sizə yetirə bilməzlər. (وَاللّٰهُ اَشَدُّ بَأْسًا وَاَشَدُّ تَنْك۪يلًا) - Allah-Təala hücum etmədə, şücaətdə və əzab etməkdə Qüreyşdən daha şiddətlidir.** (Allah-Təalanın peyğəmbərinə olan vədi doğru oldu, Hz. Peyğəmbər Əbu Süfyanla savaşmaq üçün 70 nəfərlə Mədinədən çıxdı, Allah-Təala Qüreyşin qəlbinə qorxu salıb, peyğəmbər Bədirə gəlməmiş Əbu Süfyan Qüreyş ordusu ilə Məkkəyə qayıtdı. Bu mətləbin təfsilatı Ali-İmran surəsinin 180-ci ayəsində qeyd olunmuşdu).

**85) (مَنْ يَشْفَعْ شَفَاعَةً حَسَنَةً يَكُنْ لَهُ نَص۪يبٌ مِنْهَا) - kim* mömin qardaşına xeyir və fayda yetirməkdən ötrü bir başqa şəxsə vasitəçi olsa, ona o vasitəçiliyin savabından Allah-Təala yanında bir pay var. (وَمَنْ يَشْفَعْ شَفَاعَةً سَيِّئَةً يَكُنْ لَهُ كِفْلٌ مِنْهَا) - və kim mömin qardaşına şər və zərər yetirməkdən ötrü vasitəçilik etsə, ona o vasitəçiliyin günahından Allah-Təala yanında ikiqat əzab var. (وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ مُق۪يتًا) - Allah-Təala hər bir şeyə nəzarətçi və xəbərdardır.**

وَكَانَ اللّٰهُ عَلٰى كُلِّ شَيْءٍ مُقيتًا ﴿٨٥﴾ وَاِذَا حُيِّيتُمْ بِتَحِيَّةٍ فَحَيُّوا بِاَحْسَنَ مِنْهَٓا اَوْ رُدُّوهَاۜ اِنَّ اللّٰهَ كَانَ عَلٰى كُلِّ شَيْءٍ حَسيبًا ﴿٨٦﴾ اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَۜ لَيَجْمَعَنَّكُمْ اِلٰى يَوْمِ الْقِيٰمَةِ لَا رَيْبَ فيهِۜ وَمَنْ اَصْدَقُ مِنَ اللّٰهِ حَديثًا ﴿٨٧﴾

---

**86) (وَاِذَا حُيِّيتُمْ بِتَحِيَّةٍ) - nə zaman bir şəxs sizə salam versə, (فَحَيُّوا بِاَحْسَنَ مِنْهَٓا اَوْ رُدُّوهَاۜ) - onun salamından da yaxşı və gözəl olanla onun salamını qaytarın. Ya da o şəxsin sizə verdiyi salamı onun özünə qaytarın.**

*(*Qeyd:* *"Ey islam ümməti, bir bu ayəyə baxıb onun məzmununu təfəkkür edin ki, Allah-Təala necə bizə bir-birimizə xeyir və mənfəət yetirməyi əmr edir və bir-birimizə şər və zərər yetirməyi qadağan edir. Bəs rəvadır ki, biz müsəlmanlar belə bir mübarək hökmü tərk edib həmişə bir-birimizə şər və fəsad yetirmək fikrində olaq? Vəhşi heyvanlar kimi bir-birimizi qətlə yetirib qatil şəxsə kömək edək? Necə ki bizim bu zəmanəmizdə müsəlmanlar arasında rəvacdadır. Belə şəxslərə müsəlman demək olarmı?)*

(Məsələn, bir şəxs sənə salam verib "səlamün əleyk" desə, sən onun cavabında "əleykəs-salam və rəhmətullah" de. Əgər o şəxs salamda "və rəhmətullah" desə, sən "və bərəkatuhu"nu da artır. Gözəl şəkildə salamı qaytarmaq budur. Amma salam verən şəxsin salamını qaytarmaq onun cavabında "əleykəs-səlam" deməkdir. Bu ayə salam verməyin və salamı qaytarmağın vacibliyinə dəlildir. Əgər bir şəxs salamı qaytarmasa, o şəxs günahkardır. Gərək tövbə etsin). **(اِنَّ اللّٰهَ كَانَ عَلٰى كُلِّ شَيْءٍ حَسيبًا) - həqiqətən, Allah-Təala sizdən hər bir şeyin haqq-hesabını çəkəndir.**

**87) (اَللّٰهُ لَٓا اِلٰهَ اِلَّا هُوَ لَيَجْمَعَنَّكُمْ اِلٰى يَوْمِ الْقِيٰمَةِ لَا رَيْبَ فيهِ) - haqq olan məbud Allah-Təaladır. Haqq olaraq ibadət olunan ancaq Allah-Təaladır, ondan başqa bütün məbudlar batildir. Əlbəttə, Allah-Təala sizi qiyamət günündə haqq-hesabdan ötrü toplayacaqdır. O qiyamət gününün vaqe olacağına heç bir şəkk və şübhə yoxdur. (وَمَنْ اَصْدَقُ مِنَ اللّٰهِ حَديثًا) - Allah-Təalanın bu xəbərini siz qəbul etmirsiniz, amma Allah-Təaladan doğru söz danışan kimdir? Əlbəttə, Allah-Təala bütün sözlərində sadiqdir, yalan qəbih olan şeydir, qəbih şey Allah-Təalaya layiq deyildir.** (Müsəlman şəxs gərək Allah-Təalaya tabe olub doğru danışmağa adət etsin. İnsana layiq deyil ki, yalan söz desin. Yalandan bir çox fəsad əmələ gələr. Münafiqlərdən bir qrup Mədinədə Hz. Peyğəmbərdən izin istədilər ki, Mədinədən kənarda məskun olsunlar. Mədinənin havasının onlara uyğun olmadığını səbəb göstərdilər. Hz. Peyğəmbər onlara izin verdi. Elə ki Mədinədən çıxdılar, yavaş-yavaş Mədinədən uzaqlaşıb Məkkədə müşriklərə qoşuldular. Müsəlmanlar onların haqqında ixtilaf etdilər. Bəzisi onların küfrünə, bəzisi də kafir olmadıqlarına hökm verdi. O vaxt bu ayə nazil oldu, ayədə onların küfrü bəyan edilib, ixtilaf etdikləri üçün müsəlmanlara tənə edilir. Yəni niyə küfrlə iman arasında fərq

فَمَا لَكُمْ فِي الْمُنَافِقِينَ فِئَتَيْنِ وَاللّٰهُ اَرْكَسَهُمْ بِمَا كَسَبُوا اَتُرِيدُونَ اَنْ تَهْدُوا مَنْ اَضَلَّ اللّٰهُ وَمَنْ يُضْلِلِ
اللّٰهُ فَلَنْ تَجِدَ لَهُ سَبِيلًا ﴿٨٨﴾ وَدُّوا لَوْ تَكْفُرُونَ كَمَا كَفَرُوا فَتَكُونُونَ سَوَاءً فَلَا تَتَّخِذُوا مِنْهُمْ اَوْلِيَاءَ
حَتّٰى يُهَاجِرُوا فِي سَبِيلِ اللّٰهِ فَاِنْ تَوَلَّوْا فَخُذُوهُمْ وَاقْتُلُوهُمْ حَيْثُ وَجَدْتُمُوهُمْ وَلَا تَتَّخِذُوا مِنْهُمْ
وَلِيًّا وَلَا نَصِيرًا ﴿٨٩﴾ اِلَّا الَّذِينَ يَصِلُونَ اِلٰى قَوْمٍ بَيْنَكُمْ وَبَيْنَهُمْ مِيثَاقٌ

---

qoymursunuz? Kim müsəlmanlardan kənar olub müşrik və kafirlərə qoşulsa, o şəxs islamdan çıxmış olar).

**88) (فَمَا لَكُمْ فِي الْمُنَافِقِينَ فِئَتَيْنِ) - sizə nə olubdur, ey müsəlmanlar, Məkkəyə qaçıb gedən münafiqlər haqqında iki qrup olubsunuz?** (Allah-Təala onlara münafiq deyib küfrlərini təsdiq etdi). **(وَاللّٰهُ اَرْكَسَهُمْ بِمَا كَسَبُوا) - Allah-Təala onları qazandıqları əməlləri səbəbi ilə** (mürtəd olub Məkkədə müşriklərə qoşulmalarına görə) **qaytarıb müşriklərin sırasına daxil etdi. (اَتُرِيدُونَ اَنْ تَهْدُوا مَنْ اَضَلَّ اللّٰهُ) – bəs siz müsəlmanlar istəyirsiniz ki, öz əməlləriniz səbəbi ilə Allah-Təalanın zəlalətə saldığı şəxsləri** (Məkkəyə qaçanları) **hidayət tapan müsəlmanlardan sayasınız? (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَلَنْ تَجِدَ لَهُ سَبِيلًا) -** (ey Məhəmməd), **Allah-Təala kimi zəlalətə salsa, sən onu zəlalətdən çıxartmağa bir yol tapa bilməzsən. Müşriklərə qoşulan şəxslər heç vaxt mürtədlikdən geri dönməyəcəklər.**

**89) (وَدُّوا لَوْ تَكْفُرُونَ كَمَا كَفَرُوا فَتَكُونُونَ سَوَاءً) - Məkkəyə qayıdıb kafir olanlar istəyirlər ki, siz müsəlmanlar da onlar kimi kafir olub hamınız küfrdə bərabər olasınız. (Siz isə istəyirsiniz ki, onları müsəlmanlığa daxil edəsiniz, bu, heç vaxt mümkün olan şey deyil). (فَلَا تَتَّخِذُوا مِنْهُمْ اَوْلِيَاءَ حَتّٰى يُهَاجِرُوا فِي سَبِيلِ اللّٰهِ) - Məkkədən hicrət edib sizinlə birlikdə Allah-Təala yolunda cihad edincəyə qədər siz müsəlmanlar o kafirləri özünüzə dost etməyin. (فَاِنْ تَوَلَّوْا فَخُذُوهُمْ وَاقْتُلُوهُمْ حَيْثُ وَجَدْتُمُوهُمْ) - əgər o Məkkəyə qaçanlar həmin halda sizdən üz döndərib yenidən hicrət etməsələr, o vaxt onları harda tapsanız tutub qətlə yetirin. (وَلَا تَتَّخِذُوا مِنْهُمْ وَلِيًّا وَلَا نَصِيرًا)- onlardan özünüzə nə bir dost və nə bir köməkçi tutmayın.** (İslama təfriqə salan şəxslərdən gərək uzaq olasınız)**.**

**90) (اِلَّا الَّذِينَ يَصِلُونَ اِلٰى قَوْمٍ بَيْنَكُمْ وَبَيْنَهُمْ مِيثَاقٌ) - və qeyd olunan mürtəd şəxslərin qətli vacibdir, ancaq bu mürtədlərdən o şəxslər ki sizinlə əhd edən camaata** (əhli-kitaba) **pənah aparsalar, əgər belə şəxslərə pənah aparsalar, onların ehtiramına görə, o zaman o mürtəd şəxsləri də qətlə yetirə bilməzsiniz.** (İnsaflı insanlar bu ayədə hökm olunan əhli-kitabın ehtiramını düşünüb islam dininin təməlinin insaf və mürüvvət olduğunu dərk etsinlər. Heyif olsun, islam ümməti Quranın ayələrinə əməl etməyib özlərinin zalım və islam dininin əsasının, sanki, zülm olduğunu nümayiş etdirirlər). **(اَوْ جَاؤُكُمْ حَصِرَتْ صُدُورُهُمْ اَنْ يُقَاتِلُوكُمْ اَوْ يُقَاتِلُوا قَوْمَهُمْ) - nə zaman ki qayıdıb sizin tərəfinizə**

اَوْ جَآؤُكُمْ حَصِرَتْ صُدُورُهُمْ اَنْ يُقَاتِلُوكُمْ اَوْ يُقَاتِلُوا قَوْمَهُمْ ۗ وَلَوْ شَآءَ اللّٰهُ لَسَلَّطَهُمْ عَلَيْكُمْ
فَلَقَاتَلُوكُمْ ۚ فَاِنِ اعْتَزَلُوكُمْ فَلَمْ يُقَاتِلُوكُمْ وَاَلْقَوْا اِلَيْكُمُ السَّلَمَ ۙ فَمَا جَعَلَ اللّٰهُ لَكُمْ عَلَيْهِمْ سَبِيلًا
﴿٩٠﴾ سَتَجِدُونَ اٰخَرِينَ يُرِيدُونَ اَنْ يَاْمَنُوكُمْ وَيَاْمَنُوا قَوْمَهُمْ ۗ كُلَّمَا رُدُّوٓا اِلَى الْفِتْنَةِ اُرْكِسُوا فِيهَا ۚ
فَاِنْ لَمْ يَعْتَزِلُوكُمْ وَيُلْقُوٓا اِلَيْكُمُ السَّلَمَ وَيَكُفُّوٓا اَيْدِيَهُمْ فَخُذُوهُمْ وَاقْتُلُوهُمْ حَيْثُ ثَقِفْتُمُوهُمْ ۗ

---

**gəlib islama daxil olsalar, ya da ürəkləri sıxılıb siz müsəlmanlarla, ya da öz qövmlərindən olan müşriklərlə savaşmağa meyilləri olmasa, yenə bu mürtəd olanlar öldürülə bilməzlər. (وَلَوْ شَآءَ اللّٰهُ لَسَلَّطَهُمْ عَلَيْكُمْ فَلَقَاتَلُوكُمْ) - elə deyil ki, o mürtəd olanlar sizdən qorxub savaşmırlar, əksinə, Allah-Təala onların qəlblərinə qorxu salıbdır. Əgər Allah-Təala istəsə, onları sizə hakim edib, sizinlə savaşarlar. Bir halda ki, sizinlə savaşmırlar, siz də onlarla savaşmayın. (فَاِنِ اعْتَزَلُوكُمْ فَلَمْ يُقَاتِلُوكُمْ وَاَلْقَوْا اِلَيْكُمُ السَّلَمَلا فَمَا جَعَلَ اللّٰهُ لَكُمْ عَلَيْهِمْ سَبِيلًا) - əgər o mürtəd olanlar sizdən kənar olub uzaq yerdə məskun olub, sizinlə savaşmayıb, sizə itaət etməyi izhar etsələr, belə halda Allah-Təala onlardan ötrü sizə bir yol verməyibdir ki, onları qətl edib, ya da əziyyət edəsiniz, bu bir neçə halda müşriklərə əziyyət edib qətlə yetirmək siz müsəlmanlara qadağandır.** (İslam dininə tənə edənlər bu ayəyə baxıb diqqət etsinlər ki, Haqq-Təala müsəlmanlara müşrik və bütpərəstlərlə necə rəftar etməyi, sülh içində olmağı əmr edir və bundan nümunə götürərək müsəlmanlar da gərək bir-biriləri ilə mehriban və xoşrəftar olsunlar. İslamın əsası sülh və xoş rəftar olmaqdır. Necə ki Hz. Peyğəmbər buyurubdur: "O şəxsə müsəlman deyilir ki, xalq onun əlindən və dilindən əmin-amanlıqda olsun". Bəni-Əsəd və Qətafan qəbilələrindən bir qrup Mədinəyə gəlib müsəlman olduqlarını izhar etdi, müsəlmanlar da onlardan xatircəm oldular. Elə ki öz yurdlarına qayıtdılar, fürsət tapıb qəfildən bixəbər müsəlmanların üstünə hücum edib qətl və qarət etdilər. Gələn ayə o camaat haqqında nazil oldu).

**91) (سَتَجِدُونَ اٰخَرِينَ يُرِيدُونَ اَنْ يَاْمَنُوكُمْ وَيَاْمَنُوا قَوْمَهُمْ) - mürtəd olub Məkkəyə gedənlərdən başqa bir qrupla da** (bəni-Əsəd və Qətafan) **rastlaşarsınız, o camaat iman izharı etməklə istəyirdilər ki, öz tərəflərindən sizi arxayın etsinlər ki, siz də onlardan qafil olasınız və öz qövmlərini də sizdən xatircəm etsinlər ki, sizdən onlara heç bir əziyyət yetişməyəcəkdir. (كُلَّمَا رُدُّوٓا اِلَى الْفِتْنَةِ اُرْكِسُوا فِيهَا) - amma nə zaman ki sizinlə savaşmağa dəvət olunsalar, qayıdıb dərhal savaşa daxil olarlar, həm də digər düşmənlərdən betər olarlar. (فَاِنْ لَمْ يَعْتَزِلُوكُمْ وَيُلْقُوٓا اِلَيْكُمُ السَّلَمَ وَيَكُفُّوٓا اَيْدِيَهُمْ فَخُذُوهُمْ وَاقْتُلُوهُمْ حَيْثُ ثَقِفْتُمُوهُمْ) - əgər o camaat sizinlə savaşmaqdan kənar olmayıb, itaət etməyib, sizə zərər yetirməkdən əllərini saxlamasalar, o vaxt onları harda tapsanız, tutub qətlə yetirin. (وَاُولٰٓئِكُمْ جَعَلْنَا لَكُمْ عَلَيْهِمْ سُلْطَانًا مُبِينًا) - qeyd olunan camaatı**

وَاُولٰٓئِكُمْ جَعَلْنَا لَكُمْ عَلَيْهِمْ سُلْطَانًا مُبِينًا ﴿٩١﴾ وَمَا كَانَ لِمُؤْمِنٍ اَنْ يَقْتُلَ مُؤْمِنًا اِلَّا خَطَـًٔا وَمَنْ قَتَلَ
مُؤْمِنًا خَطَـًٔا فَتَحْرِيرُ رَقَبَةٍ مُؤْمِنَةٍ وَدِيَةٌ مُسَلَّمَةٌ اِلٰٓى اَهْلِهٖٓ اِلَّا اَنْ يَصَّدَّقُوا فَاِنْ كَانَ مِنْ قَوْمٍ عَدُوٍّ لَكُمْ
وَهُوَ مُؤْمِنٌ فَتَحْرِيرُ رَقَبَةٍ مُؤْمِنَةٍ وَاِنْ كَانَ مِنْ قَوْمٍ بَيْنَكُمْ وَبَيْنَهُمْ مِيثَاقٌ فَدِيَةٌ مُسَلَّمَةٌ اِلٰٓى اَهْلِهٖ وَتَحْرِيرُ
رَقَبَةٍ مُؤْمِنَةٍ فَمَنْ لَمْ يَجِدْ فَصِيَامُ شَهْرَيْنِ مُتَتَابِعَيْنِ تَوْبَةً مِنَ اللّٰهِ وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًا ﴿٩٢﴾

---

**qətlə yetirmək üçün sizə aşkar olan hakimiyyət və ixtiyar verdik.** (Gələn ayə insan qətli barəsindədir. İnsan qətli 3 qisimdə təsəvvür olunur. 1- qəsdən birini qətlə yetirmək. 2-Səhvən qətlə səbəb olmaq. Məsələn, bir şəxs quşa güllə atan zaman insana dəyib onu həlak edə bilər. 3- qəsdə oxşayan xəta üzrə vaqe olsa, məsələn, müəllim uşağı döyərkən, uşaq onun zərbəsindən ölsə, bunların hər ikisinin hökmü kəffarədə birdir. Amma diyəti başqadır. Bundan sonra qeyd olunacaqdır. Qəsdən və xəta ilə öldürmənin hər birinin hökmü sıradakı ayələrdə təfsilatı ilə bəyan ediləcək).

**92) (وَمَا كَانَ لِمُؤْمِنٍ اَنْ يَقْتُلَ مُؤْمِنًا اِلَّا خَطَـًٔا) - xəta ilə olmanın xaricində, heç bir mömindən ötrü caiz deyil ki, başqa bir mömin şəxsi qəsdən qətlə yetirsin.** (Çünki xəta edən insanın üzrxahlığı qəbul edilər)**. (وَمَنْ قَتَلَ مُؤْمِنًا خَطَـًٔا) - kim bir mömin şəxsi xəta üzrə qətlə yetirsə,** (onun hökmü budur ki, qeyd olunur)**. (فَتَحْرِيرُ رَقَبَةٍ مُؤْمِنَةٍ وَدِيَةٌ مُسَلَّمَةٌ اِلٰٓى اَهْلِهٖٓ اِلَّا اَنْ يَصَّدَّقُوا) - o qatilə lazımdır ki, ondan ötrü bir mömin qulamı azad etsin və bir də o öldürülənin diyətini əgər ona bağışlamasalar, onun varislərinə versin. Əgər bağışlasalar, qatilə ancaq həmin qulamı azad etmək lazımdır.** (Bu kəlam buna işarədir ki, səhvən qətldə diyəti bağışlamaq yaxşıdır). **(فَاِنْ كَانَ مِنْ قَوْمٍ عَدُوٍّ لَكُمْ وَهُوَ مُؤْمِنٌ فَتَحْرِيرُ رَقَبَةٍ مُؤْمِنَةٍ) - əgər səhvən öldürülən şəxs sizə düşmən olan qövmdən olsa, sizinlə onların arasında əhd-peyman olmasa, amma o öldürülən özü mömin olsa, ondan ötrü bir mömin qulam azad etmək lazımdır.** (Burada diyət yoxdur, çünki öldürülən özü mömindir, amma onun varisləri müşrik olub onlarla əhd-peyman olmayanda müşriklər ona varis olduğundan, öldürüləndən ötrü diyət verilməlidir)**. (وَاِنْ كَانَ مِنْ قَوْمٍ بَيْنَكُمْ وَبَيْنَهُمْ مِيثَاقٌ فَدِيَةٌ مُسَلَّمَةٌ اِلٰٓى اَهْلِهٖ وَتَحْرِيرُ رَقَبَةٍ مُؤْمِنَةٍ) - əgər səhvən öldürülən şəxs sizinlə onların aralarında əhd-peyman olan camaatdan** (yəhudi və xristianlardan) **olsa, o öldürüləndən ötrü onun varislərinə diyət vermək, bir də mömin bir qulam azad etmək lazımdır. (فَمَنْ لَمْ يَجِدْ فَصِيَامُ شَهْرَيْنِ مُتَتَابِعَيْنِ تَوْبَةً مِنَ اللّٰهِ) - əgər mömin qulam tapmasa, onun əvəzinə qatil gərək iki ay dalbadal oruc tutsun. Bu iki ay oruc tutmaq Allah-Təala tərəfindən qulam azad etməyin əvəzində qəbul olunar. (وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًا) - Allah-Təala məxluqatının əhvalından agahdır. Onlardan ötrü hikmətli hökmlər veribdir.** (İnsaflı insanlar bu ayənin məzmununa baxsınlar ki, islamda qətl məsələsində əhli-kitabın hökmü müsəlmanlarla necə

bərabər səviyyədə qəbul edilib. Ondan sonra islamın haqq olduğunu və özgə dinlərdən üstünlüyünü anlasınlar. Bu hökmlər tamamən səhvən olan qətldən ötrü qeyd olundu. Qulamı azad etmək qatilin öz malı hesabına olmalıdır. Amma diyəti onun qohum-əqrəbası verməlidir, o qatilin qohum-əqrəbası o diyəti öz aralarında toplayıb, öldürülən şəxsin varislərinə verərlər. Qəsdən adam öldürmədə diyətin miqdarı bu qeyd olunan şeylərin biridir; 1- 100 ədəd yetkin dəvə.2- 200 ədəd öküz. 3- 1000 ədəd qoyun. 4- min misqal qızıl (1 misqal: 4, 5 gr.-dır). 5- 10 min misqal gümüş. Bu şeylərin hansı biri mümkün olsa, gərək onu versin. Amma qəsdə oxşayan qətldə diyətin miqdarı belədir: a) anaları yenidən doğub süd sahibi ola bilən 33 dişi dəvə (yəni elə dəvə ki, yanında süd əmən balası olsun. Ondan əvvəlki balası iki yaşından 3 yaşınadək olar), b) yenə 33 dişi dəvə ki, onların yaşları 3-dən 4-ə qədər olsun, c) yenə 34 dişi dəvə ki, onların yaşları 6, özləri də hamilə olsunlar. Hamısı bir yerdə 100 dəvə edər. Səhvən olanın diyəti belədir: a) anaları yenidən doğa bilən 20 dişi dəvə, b) anaları yenidən doğub süd sahibi ola bilən 20 erkək dəvə, c) anaları yenidən doğub süd sahibi ola bilən 30 dişi dəvə, d) 30 dişi dəvə ki, 3-dən 4 yaşınadək olsunlar. Bu da bir yerdə 100 dəvə edər. Qəsdə oxşayan qətldə diyət qatilin malından verilər. Amma səhvən olan qətldə diyəti qohum-əqrəbası verər. Bu qeyd olunan diyətlərin hamısı azad kişinin diyətidir. Amma azad qadının diyəti bütün hallarda kişinin diyətinin yarısıdır. Qulamla, kənizin diyəti hər bir halda onların qiymətləri qədərdir. Səhvən qətldə diyətin 3 il vaxtı vardır. Qəsdə oxşayanın iki il, qəsdən olanda bir il vaxtı vardır. Səhvən və qəsdə oxşayanda varislərin qisas almağa ixtiyarları yoxdur. Amma qəsdən qətldə varis diyət almaqla qisas arasında azaddır. Bir də qəsdən qətl haqqında olan ayənin mənasına görə qatilin tövbəsi qəbul edilməz).

**93) (وَمَنْ يَقْتُلْ مُؤْمِنًا مُتَعَمِّدًا) -** (bu ayə qəsdən qətl haqqındadır)**, kim mömin* bir şəxsi qəsdən qətlə yetirsə,**

*(****Qeyd:*** *Yazıqlar olsun o şəxsin halına ki, bu ayəni eşidəndən sonra adam öldürür. Adam öldürməyin günahı, əzabı və lənəti haqqında bu ayədə verilən vədlər başqa heç bir günah haqqında varid olmayıbdır. İbn Abbasdan rəvayət olunubdur ki, qəsdən adam öldürənin tövbəsi qəbul edilən deyildir. (Buxari, Mənaqibu'l-Ənsar 29, Təfsiru-surə 4/16; Müslüm, Təfsiru-Surə 4/16) Hz. Peyğəmbər buyurubdur: "Dünyanın yox olması Allah-Təala yanında bir insanın öldürülməsindən daha dəyərsizdir" (Tirmizi, Diyat 7; İbn Macə, Diyat 1). Yenə başqa bir hədisdə buyurub:"Əgər bir şəxsi məşriq tərəfində qətlə yetirsələr və məğrib tərəfində olan başqa bir şəxs onun qətlinə razı olsa, hər halda onun qanına şərikdir" (İbn Macə, Diyat 1). Başqa bir hədisdə buyurubdur: "Kim bir şəxsin qətlinə yarım kəlmə sözlə də kömək etsə, o şəxs qiyamət günündə elə bir halda gələr ki, onun iki gözünün arasında "bu şəxs Allah-*

فَجَزَآؤُهُ جَهَنَّمُ خَالِدًا فِيهَا وَغَضِبَ اللّٰهُ عَلَيْهِ وَلَعَنَهُ وَاَعَدَّ لَهُ عَذَابًا عَظِيمًا ﴿٩٣﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا
اِذَا ضَرَبْتُمْ فِي سَبِيلِ اللّٰهِ فَتَبَيَّنُوا وَلَا تَقُولُوا لِمَنْ اَلْقٰى اِلَيْكُمُ السَّلَامَ لَسْتَ مُؤْمِنًاۚ تَبْتَغُونَ عَرَضَ
الْحَيٰوةِ الدُّنْيَاۘ فَعِنْدَ اللّٰهِ مَغَانِمُ كَثِيرَةٌۜ كَذٰلِكَ كُنْتُمْ مِنْ قَبْلُ فَمَنَّ اللّٰهُ عَلَيْكُمْ فَتَبَيَّنُواۜ اِنَّ اللّٰهَ كَانَ بِمَا
تَعْمَلُونَ خَبِيرًا ﴿٩٤﴾ لَا يَسْتَوِي الْقَاعِدُونَ مِنَ الْمُؤْمِنِينَ غَيْرُ اُولِي الضَّرَرِ وَالْمُجَاهِدُونَ فِي سَبِيلِ
اللّٰهِ بِاَمْوَالِهِمْ وَاَنْفُسِهِمْۜ فَضَّلَ اللّٰهُ الْمُجَاهِدِينَ بِاَمْوَالِهِمْ وَاَنْفُسِهِمْ عَلَى الْقَاعِدِينَ دَرَجَةًۜ

---

*Təalanın rəhmətindən ümidsizdir" sözü yazılar". Bu kimi hədislər və ayələr, sanki, müsəlmanların arasından birdəfəlik götürülüb, qətl hadisələri rəvac tapıb, vəhşiliyi özlərindən ötrü şüar edib, insanlıq xüsusiyyətindən və ədəbdən kənar olublar. Bunun səbəbi Quran ehkamını tərk edib, nəfsani arzulara tabe olmaqdır).*

**(فَجَزَآؤُهُ جَهَنَّمُ خَالِدًا فِيهَا) - onun cəzası cəhənnəmdir, həmişəlik orada qalacaqdır. (وَغَضِبَ اللّٰهُ عَلَيْهِ وَلَعَنَهُ) - Allah-Təala ona qəzəb və lənət edər.** (Allah-Təala onu öz rəhmətindən kənar edər). **(وَاَعَدَّ لَهُ عَذَابًا عَظِيمًا) - ondan ötrü cəhənnəmdə böyük əzab hazır edibdir.**

**94) (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اِذَا ضَرَبْتُمْ فِي سَبِيلِ اللّٰهِ فَتَبَيَّنُوا) -** (ayədə müsəlmanlara əmr edilir ki, cihad vaxtı müşriklərin arasında bir nəfər müsəlmanı da qətl etməməyə diqqət etsinlər)**. Ey iman gətirən şəxslər, nə zaman ki Allah-Təala yolunda cihad etməyə çıxdınız, hər bir şəxsə çatan kimi onu dərhal qətlə yetirməyin, fikir verib araşdırın ki, bəlkə, onların arasında bir müsəlman şəxs ola bilər. (وَلَا تَقُولُوا لِمَنْ اَلْقٰى اِلَيْكُمُ السَّلَامَ لَسْتَ مُؤْمِنًاۚ) - kim iman izharı edib, itaət edib mən müsəlmanam desə, siz ona deməyin ki, "sən müsəlman deyilsən". Onu qətlə yetirib malına malik olmayın. (تَبْتَغُونَ عَرَضَ الْحَيٰوةِ الدُّنْيَاۘ فَعِنْدَ اللّٰهِ مَغَانِمُ كَثِيرَةٌ) - o şəxsi öldürməklə dünya mənfəəti istəyirsiniz, amma daha çox qənimət Allah-Təalanın yanındadır. (كَذٰلِكَ كُنْتُمْ مِنْ قَبْلُ) - əgər siz iman edənlərdən bu izharı qəbul etmirsizsə, habelə siz də onlar kimi idiniz. Bəs sizdən niyə qəbul etdilər? (فَمَنَّ اللّٰهُ عَلَيْكُمْ فَتَبَيَّنُواۜ اِنَّ اللّٰهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبِيرًا) - Allah-Təala sizə minnət qoyub sizi islamla məşhur etdi. Siz də islama daxil olanlarla yaxşı rəftar edin. Əlbəttə, araşdırıb fikir verin ki, müsəlman şəxsi qətlə yetirməyəsiniz. Həqiqətən, Allah-Təala etdiyiniz hər bir şeydən xəbərdardır.**

**95) (لَا يَسْتَوِي الْقَاعِدُونَ مِنَ الْمُؤْمِنِينَ غَيْرُ اُولِي الضَّرَرِ وَالْمُجَاهِدُونَ فِي سَبِيلِ اللّٰهِ بِاَمْوَالِهِمْ وَاَنْفُسِهِمْ) - möminlərdən bədənlərində heç bir zərər olmayıb (naxoş, kor və şil olmadığı halda) cihada getməyən şəxslərlə cihada gedib Allah-Təala yolunda mal və canlarıyla cihad edən şəxslər eyni deyildir. (فَضَّلَ اللّٰهُ الْمُجَاهِدِينَ بِاَمْوَالِهِمْ وَاَنْفُسِهِمْ عَلَى الْقَاعِدِينَ دَرَجَةً) - Allah-Təala mal və canlarıyla cihada gedənləri axirətdəki dərəcələri səbəbinə cihada getməyənlərdən**

وَكُلًّا وَعَدَ اللّٰهُ الْحُسْنٰىۜ وَفَضَّلَ اللّٰهُ الْمُجَاهِدِينَ عَلَى الْقَاعِدِينَ اَجْرًا عَظِيمًاۙ ﴿٩٥﴾ دَرَجَاتٍ مِنْهُ
وَمَغْفِرَةً وَرَحْمَةً ۜ وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا ۟ ﴿٩٦﴾ اِنَّ الَّذِينَ تَوَفّٰيهُمُ الْمَلٰٓئِكَةُ ظَالِمِيٓ اَنْفُسِهِمْ
قَالُوا فِيمَ كُنْتُمْ ۜ قَالُوا كُنَّا مُسْتَضْعَفِينَ فِي الْاَرْضِۜ قَالُوٓا اَلَمْ تَكُنْ اَرْضُ اللّٰهِ وَاسِعَةً فَتُهَاجِرُوا فِيهَاۜ
فَاُولٰٓئِكَ مَاْوٰيهُمْ جَهَنَّمُۜ وَسَٓاءَتْ مَصِيرًاۙ ﴿٩٧﴾ اِلَّا الْمُسْتَضْعَفِينَ مِنَ الرِّجَالِ وَالنِّسَٓاءِ وَالْوِلْدَانِ لَا
يَسْتَطِيعُونَ حِيلَةً وَلَا يَهْتَدُونَ سَبِيلًا ﴿٩٨﴾ فَاُولٰٓئِكَ عَسَى اللّٰهُ اَنْ يَعْفُوَ عَنْهُمْ ۜ

---

**üstün edibdir. (وَكُلًّا وَعَدَ اللّٰهُ الْحُسْنٰىۜ) - cihada gedən və getməyən möminlərin hamısına Allah-Təala savab vədi veribdir. (وَفَضَّلَ اللّٰهُ الْمُجَاهِدِينَ عَلَى الْقَاعِدِينَ اَجْرًا عَظِيمًاۙ) - amma cihada gedənləri getməyənlərə nisbətən böyük əcr və savab səbəbi ilə üstün edibdir.**

**96) (دَرَجَاتٍ مِنْهُ وَمَغْفِرَةً وَرَحْمَةً وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا) - cihada gedənlərdən ötrü Allah-Təala tərəfindən axirətdə necə dərəcələr, savab və Allah-Təalanın rəhməti və bağışlamağı vardır. Allah-Təala öz məxluquna rəhm edib bağışlayandır.** (Məkkə əhlindən bir neçə nəfər şəxs Məkkədə imanlarını izhar edib, amma Mədinəyə peyğəmbərin yanına hicrət etmədilər. Elə ki Bədir savaşı oldu, onlar da müşriklərlə birlikdə Hz. Peyğəmbərlə müharibə etməyə gəlib, həmin savaşda öldürüldülər. Sıradakı ayə onların haqqında nazil oldu).

**97) (اِنَّ الَّذِينَ تَوَفّٰيهُمُ الْمَلٰٓئِكَةُ ظَالِمِيٓ اَنْفُسِهِمْ) - həqiqətən, o şəxslər ki** (Bədir savaşında) **özlərinə zülm edib, müşriklərə kömək edirdilər, mələklər onları vəfat etdirib canlarını alarkən, (قَالُوا فِيمَ كُنْتُمْ) - mələklər onlara dedilər: "Dünyada din işində nə əməliniz var idi?"** (Bir halda ki, Mədinəyə hicrət etməyə qadir olarkən, hicrət etmədiniz). **(قَالُوا كُنَّا مُسْتَضْعَفِينَ فِي الْاَرْضِ) - onlar cavabda dedilər: "Biz Məkkədə zəif şəxslər idik, hicrət etməyə qüdrətimiz yox idi". (قَالُوٓا اَلَمْ تَكُنْ اَرْضُ اللّٰهِ وَاسِعَةً فَتُهَاجِرُوا فِيهَا) - mələklər onlara dedilər: "Yalan deyirsiniz, bəlkə, siz hicrət etməyə qadir idiniz, hicrət etmədiniz, bəs Allah-Təalanın yer üzü geniş deyildi ki, hicrət edib bir tərəfə gedəydiniz ki, dininizi aşkar edəydiniz".** (Necə ki Həbəşistana, ya da Mədinəyə hicrət etdilər). **(فَاُولٰٓئِكَ مَاْوٰيهُمْ جَهَنَّمُۜ وَسَٓاءَتْ مَصِيرًاۙ) - o müsəlmanlıq iddiası edib, Bədir savaşında öldürülən şəxslərin məkanı cəhənnəmdir və nə pis qayıdılacaq yerdir ora.**

**98) (اِلَّا الْمُسْتَضْعَفِينَ مِنَ الرِّجَالِ وَالنِّسَٓاءِ وَالْوِلْدَانِ لَا يَسْتَطِيعُونَ حِيلَةً وَلَا يَهْتَدُونَ سَبِيلًا) - ancaq zəif və aciz olan şəxslərdən - kişilərdən, qadınlardan və ya uşaqlardan hicrət etmək üçün çarə tapmağa qüdrətləri olmayıb yola da bələd olmayan şəxslərdən başqa, Məkkədə iman izharı edib hicrət etməyənlər cəhənnəm əhlidir.**

وَكَانَ اللّٰهُ عَفُوًّا غَفُورًا ﴿٩٩﴾ وَمَنْ يُهَاجِرْ فِي سَبِيلِ اللّٰهِ يَجِدْ فِي الْاَرْضِ مُرَاغَمًا كَثِيرًا وَسَعَةً وَمَنْ
يَخْرُجْ مِنْ بَيْتِهِ مُهَاجِرًا اِلَى اللّٰهِ وَرَسُولِهِ ثُمَّ يُدْرِكْهُ الْمَوْتُ فَقَدْ وَقَعَ اَجْرُهُ عَلَى اللّٰهِ وَكَانَ اللّٰهُ غَفُورًا
رَحِيمًا ﴿١٠٠﴾ وَاِذَا ضَرَبْتُمْ فِي الْاَرْضِ فَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَنْ تَقْصُرُوا مِنَ الصَّلٰوةِ اِنْ خِفْتُمْ اَنْ
يَفْتِنَكُمُ الَّذِينَ كَفَرُوا اِنَّ الْكَافِرِينَ كَانُوا لَكُمْ عَدُوًّا مُبِينًا ﴿١٠١﴾

---

**99) (فَاُولٰئِكَ عَسَى اللّٰهُ اَنْ يَعْفُوَ عَنْهُمْ وَكَانَ اللّٰهُ عَفُوًّا غَفُورًا) - bu qeyd olunan zəif şəxslər ümidvar olsunlar ki, Allah-Təala onları bağışlayar, Allah-Təala günahdan keçib bağışlayandır.** (Hicrət barəsində qeyd olunan ayələri Hz. Peyğəmbər Məkkəyə göndərdi. Müsəlmanlardan bir qoca kişi - Cündüb ibn Zamrə xəstə idi. Elə ki bu ayələri eşitdi, oğullarına dedi: “Məni Mədinəyə tərəf aparın, mən zəiflərdən deyiləm. Mədinənin yoluna yaxşı agaham. Vallah, bu gecəni də Məkkədə qalmaram”. Oğulları onu bir taxta parçasının üstünə qoydu, Mədinə tərəfinə getməyə başladılar, elə ki Məkkədən kənar olub Tənim adlı yerə yetişdilər, orada vəfat etdi. Müşriklər onun ölməyinə şad oldular ki, istədiyinə çatmadı. O vaxt sıradakı ayə nazil oldu (Buxari, Təfsiru-Surə 4/19- Fitən 12)).

**100) (وَمَنْ يُهَاجِرْ فِي سَبِيلِ اللّٰهِ يَجِدْ فِي الْاَرْضِ مُرَاغَمًا كَثِيرًا وَسَعَةً) - kim Allah-Təala yolunda hicrət etsə, yer üzündə geniş yollar tapar, o yolları getməklə qövmündən ayrılıb onları zəlil edər.** (Necə ki Cündüb etdi). **(وَمَنْ يَخْرُجْ مِنْ بَيْتِهِ مُهَاجِرًا اِلَى اللّٰهِ وَرَسُولِهِ) - kim evindən hicrət etdiyi halda, Allah-Təala və onun peyğəmbərinin tərəfinə çıxsa, (ثُمَّ يُدْرِكْهُ الْمَوْتُ فَقَدْ وَقَعَ اَجْرُهُ عَلَى اللّٰهِ) - hicrət üçün çıxandan sonra ölüm ona gəlsə, həqiqətən, onun əcri-savabı Allah-Təalaya aiddir.** (Necə ki Cündüb ibn Zamrə Məkkədən çıxarkən ölüm onu haqladı). **(وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا) - Allah-Təala hicrət edənləri bağışlayıb onlara rəhm edəndir.**

**101) (وَاِذَا ضَرَبْتُمْ فِي الْاَرْضِ) -** (bu ayə səfərdə qorxu halətində namazı qısa etmək barəsində nazil olubdur). **Nə zaman səfər etməkdən ötrü çıxıb yer üzündə hərəkət etsəniz, (فَلَيْسَ عَلَيْكُمْ جُنَاحٌ اَنْ تَقْصُرُوا مِنَ الصَّلٰوةِ اِنْ خِفْتُمْ اَنْ يَفْتِنَكُمُ الَّذِينَ كَفَرُوا) - əgər qorxsanız ki, namaz vaxtı müşriklər sizinlə savaşıb, sizə zərər yetirərlər, o vaxt sizə günah yoxdur ki, namazı qısa edib əskik qılasınız, (namazı qısa etmək, yəni 4 rükətli namazı iki rükət qılmaqdır). (اِنَّ الْكَافِرِينَ كَانُوا لَكُمْ عَدُوًّا مُبِينًا) - həqiqətən, kafirlər sizdən ötrü aşkar olan düşməndirlər. Əlbəttə, düşməndən gərək çəkinəsiniz, xüsusilə, namaz vaxtında.** (Səfər vaxtı qorxu halətində namazı qısa etməyin caizliyi bu ayə ilə sabit olubdur. Qorxu halətində namazı qısa etməyin xüsusiyyəti bundan sonra gələn ayədə bəyan olunur. Hərçənd gələn ayə Hz. Peyğəmbərə xitabdır, amma hökmü bütün müsəlmanlara şamildir).

وَاِذَا كُنْتَ فِيهِمْ فَاَقَمْتَ لَهُمُ الصَّلٰوةَ فَلْتَقُمْ طَٓائِفَةٌ مِنْهُمْ مَعَكَ وَلْيَاْخُذُوٓا اَسْلِحَتَهُمْ فَاِذَا سَجَدُوا فَلْيَكُونُوا مِنْ وَرَٓائِكُمْ وَلْتَاْتِ طَٓائِفَةٌ اُخْرٰى لَمْ يُصَلُّوا فَلْيُصَلُّوا مَعَكَ وَلْيَاْخُذُوا حِذْرَهُمْ وَاَسْلِحَتَهُمْ وَدَّ الَّذِينَ كَفَرُوا لَوْ تَغْفُلُونَ عَنْ اَسْلِحَتِكُمْ وَاَمْتِعَتِكُمْ فَيَمِيلُونَ عَلَيْكُمْ مَيْلَةً وَاحِدَةً وَلَا جُنَاحَ عَلَيْكُمْ اِنْ كَانَ بِكُمْ اَذًى مِنْ مَطَرٍ اَوْ كُنْتُمْ مَرْضٰٓى اَنْ تَضَعُوٓا اَسْلِحَتَكُمْ وَخُذُوا حِذْرَكُمْ اِنَّ اللّٰهَ اَعَدَّ لِلْكَافِرِينَ عَذَابًا مُهِينًا ﴿١٠٢﴾

---

**102) (**وَاِذَا كُنْتَ فِيهِمْ فَاَقَمْتَ لَهُمُ الصَّلٰوةَ**)** – (ey Məhəmməd), **nə zaman ki* səfərdə camaatın arasında qorxu haləti içində camaatla namaz qılmağa başlasan, gərək, bu şəkildə namaz qılasan: (**فَلْتَقُمْ طَٓائِفَةٌ مِنْهُمْ مَعَكَ وَلْيَاْخُذُوٓا اَسْلِحَتَهُمْ**) - gərək o camaat iki qrup olsun. Onlardan bir qrup səninlə namazda duranda silahlarını yanlarında götürsün, silahsız namaz qılmasınlar, o biri qrup da sonra namaz qılsın, (**فَاِذَا سَجَدُوا فَلْيَكُونُوا مِنْ وَرَٓائِكُمْ**) - nə zaman ki bu namaz qılan dəstə səninlə birlikdə səcdə etdilər, gərək, namaz qılmayan dəstə sizdən kənarda durub sizi düşməndən mühafizə etsinlər.** (Bu şəkildə imam bir rükət namazı birinci dəstə ilə qılar, ondan sonra imam ikinci rükətdə ayaq üstündə durduğu halda bu dəstə özləri təcili ikinci rükəti qılıb tamamlayarlar. Ondan sonra durub gedib ikinci dəstənin yerində durarlar. İkinci dəstə gəlib imama qoşular. İmam ikinci rükəti onlarla qılar, ondan sonra imam təşəhhüd halında durar. Onlar ikinci rükəti təcili qılıb, imama yetişərlər. İmam onlarla birlikdə salam verib namazı tamamlayar. Necə ki ayədə xəbər verir)**. (**وَلْتَاْتِ طَٓائِفَةٌ اُخْرٰى لَمْ يُصَلُّوا فَلْيُصَلُّوا مَعَكَ**)** – (ey Məhəmməd), **elə ki birinci dəstə namazlarını tamamladı, səninlə birlikdə namaz qılmayan o biri dəstə gərək gəlib səninlə birlikdə namaz qılsın** (Necə ki qeyd olundu). **(**وَلْيَاْخُذُوا حِذْرَهُمْ وَاَسْلِحَتَهُمْ**) - bu qrup da gərək, namaz əsnasında düşməndən qorxu içində olub namazda silahlarını götürsün. (**وَدَّ الَّذِينَ كَفَرُوا لَوْ تَغْفُلُونَ عَنْ اَسْلِحَتِكُمْ وَاَمْتِعَتِكُمْ فَيَمِيلُونَ عَلَيْكُمْ مَيْلَةً وَاحِدَةً**) - kafirlər istəyərlər ki, kaş siz namaz vaxtı silahlarınızdan və mallarınızdan qafil olasınız ki, o anda hamısı birdən üzərinizə hücum edib sizi qətlə yetirib, mallarınızı qarət etsinlər. (**وَلَا جُنَاحَ عَلَيْكُمْ اِنْ كَانَ بِكُمْ اَذًى مِنْ مَطَرٍ اَوْ كُنْتُمْ مَرْضٰٓى اَنْ تَضَعُوٓا اَسْلِحَتَكُمْ وَخُذُوا حِذْرَكُمْ**) - əgər xəstə olsanız, ya da yağışdan əziyyət çəkdiyinizdə namazda silahınızı götürmək sizə çətin olsa, o zaman silahı kənara qoymağınız caizdir. Amma gərək ehtiyatlı olasınız ki, silahınızı çox kənara qoymayasınız, nə vaxt düşmən sizə hücum etsə, o anda silahı götürüb savaşa hazır olasınız. (**اِنَّ اللّٰهَ اَعَدَّ لِلْكَافِرِينَ عَذَابًا مُهِينًا**) - həqiqətən, Allah-Təala kafirlərdən ötrü onları zəlil edən əzab hazır edibdir.**

*(***Qeyd:** Müsəlmanlar, gərək, qəflət yuxusundan oyanıb təfəkkür etsinlər ki, Allah-Təala namaz barəsində nə qədər möhkəm hökmlər buyurubdur, hətta savaş və qorxu məqamında da buyurur: gərək, namaz qılınsın. Heyif ki, müsəlmanlar Qurani-Şərifin*

فَاِذَا قَضَيْتُمُ الصَّلٰوةَ فَاذْكُرُوا اللّٰهَ قِيَامًا وَقُعُودًا وَعَلٰى جُنُوبِكُمْۚ فَاِذَا اطْمَاْنَنْتُمْ فَاَقِيمُوا الصَّلٰوةَۚ اِنَّ
الصَّلٰوةَ كَانَتْ عَلَى الْمُؤْمِنِينَ كِتَابًا مَوْقُوتًا﴿١٠٣﴾ وَلَا تَهِنُوا فِي ابْتِغَٓاءِ الْقَوْمِۜ اِنْ تَكُونُوا تَاْلَمُونَ
فَاِنَّهُمْ يَاْلَمُونَ كَمَا تَاْلَمُونَۚ وَتَرْجُونَ مِنَ اللّٰهِ مَا لَا يَرْجُونَۜ وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًاࣖ ﴿١٠٤﴾

---

*hökmünə əməl etməyirlər, az qalıbdır ki, bu böyük ibadət müsəlmanlar tərəfindən tamamilə tərk olunsun. O vaxt nə din qalar və nə də millət. Avropa alimləri namazı tərifləyirlər, bu gözəl ibadətin savab və əcrindən başqa insan bədəninə olan xeyir və mənfəətinə diqqət etmirlər ki, insan bədəninin (əsəb) damarlarını necə möhkəm edib könlünü saf və şad saxlayır? Bu mövzuda ingilis şeyxi Abdullah Küveyliyam Ceyms Montqomeridən, bir də doktor Marks Dotsdan qəsidə nəql edir, kim bu kitabla tanış olmaq istəsə, tapa bilər. Hərçənd ingilis dilində yazılıbdır, amma başqa dillərə də tərcümə edilibdir. O kitabı oxuduqda, namazın həqiqəti daha aydın məlum olur. .......).*

**103) (فَاِذَا قَضَيْتُمُ الصَّلٰوةَ) – nə zaman namazı qorxu içində qılsanız, (فَاذْكُرُوا اللّٰهَ قِيَامًا وَقُعُودًا وَعَلٰى جُنُوبِكُمْۚ) - ondan sonra ayaq üstə, əyləşdiyiniz halda və uzandığınız halda Allah-Təalanı zikr edin. (فَاِذَا اطْمَاْنَنْتُمْ فَاَقِيمُوا الصَّلٰوةَ) - elə ki düşməndən arxayın oldunuz, o vaxt namazı öz qaydasıyla - yaxşı və gözəl şəkildə qılın. Heç vaxt namazı tərk etməyin.** (Ayənin bu qismi ancaq qorxu halında səfər namazının qısa olacağına işarədir). **(اِنَّ الصَّلٰوةَ كَانَتْ عَلَى الْمُؤْمِنِينَ كِتَابًا مَوْقُوتًا)- həqiqətən, namaz möminlərin üzərinə yazılan müəyyən vaxtlarda vacib olan bir ibadətdir, o vaxtları təxirə salmaq caiz deyil.**

**104) (وَلَا تَهِنُوا فِي ابْتِغَٓاءِ الْقَوْمِۜ) - ey müsəlmanlar, müşriklərlə savaşda tənbəl və zəif olmayın. (اِنْ تَكُونُوا تَاْلَمُونَ فَاِنَّهُمْ يَاْلَمُونَ كَمَا تَاْلَمُونَ) - əgər siz yaranızdan əziyyət çəkirsinizsə, həqiqətən, müşriklər də yaradan əziyyət çəkirlər, necə ki siz çəkirsiniz. Bununla belə müşriklər savaşdan vaz keçmirlər, əlbəttə, siz də tənbəllik etməyin. (وَتَرْجُونَ مِنَ اللّٰهِ مَا لَا يَرْجُونَۜ وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًاࣖ) - halbuki siz Allah-Təaladan o əcr və savabı ümid edirsiniz ki, onlar ümid etmirlər, Allah-Təala sizin hər bir işinizdən agahdır, sizə hər bir təklifi hikmətlə veribdir.** (Mədinədə Tumə ibn Übeyriq öz qonşusu Qətadə ibn Numanın evindən bir zireh oğurladı, o zireh bir çuvalın içində idi, o çuvalda un var idi, o zirehi də o çuvalla aparanda o çuvalın dibindən un tökülürdü. Həmin halda aparıb yəhudi Zeyd ibn Səminə tapşırdı. Ertəsi gün zireh sahibi xəbərdar oldu, Tumənin evini axtardılar, tapılmadı, and içdi ki, xəbərdar deyiləm. Ondan sonra çuvaldan tökülən unun izi ilə gedib –yəhudi Zeydin evinə çatdılar. Yəhudi dedi: “Bunu mənə Tumə veribdir”. Bir neçə yəhudi də buna şahidlik etdi. Tumə bəni-Zəfər tayfasından idi. Özləri də müsəlman idilər. Toplanıb dedilər: “Gəlin Hz. Peyğəmbərin hüzuruna gedək”. Zahirdə zireh yəhudidə tapıldığından Hz. Peyğəmbər istədi ki, yəhudinin əlinin kəsilməsinə hökm versin. O vaxt gələn ayə və ondan başqa bir neçə ayə nazil oldu, hərçənd ayələr Tumə haqqında nazil olubdur, amma ayələrin hökmü bütün müsəlmanlara şamildir).

إِنَّآ اَنْزَلْنَآ اِلَيْكَ الْكِتَابَ بِالْحَقِّ لِتَحْكُمَ بَيْنَ النَّاسِ بِمَآ اَرٰيكَ اللّٰهُ ۜ وَلَا تَكُنْ لِلْخَآئِنِينَ خَصِيمًا ۙ﴿١٠٥﴾
وَاسْتَغْفِرِ اللّٰهَ ۜ اِنَّ اللّٰهَ كَانَ غَفُورًا رَحِيمًا ۚ﴿١٠٦﴾ وَلَا تُجَادِلْ عَنِ الَّذِينَ يَخْتَانُونَ اَنْفُسَهُمْ ۜ اِنَّ اللّٰهَ لَا
يُحِبُّ مَنْ كَانَ خَوَّانًا اَثِيمًا ۙ﴿١٠٧﴾ يَسْتَخْفُونَ مِنَ النَّاسِ وَلَا يَسْتَخْفُونَ مِنَ اللّٰهِ وَهُوَ مَعَهُمْ اِذْ يُبَيِّتُونَ مَا
لَا يَرْضٰى مِنَ الْقَوْلِ ۜ وَكَانَ اللّٰهُ بِمَا يَعْمَلُونَ مُحِيطًا﴿١٠٨﴾ هَآ اَنْتُمْ هٰؤُلَآءِ جَادَلْتُمْ عَنْهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا

---

**105) (اِنَّآ اَنْزَلْنَآ اِلَيْكَ الْكِتَابَ بِالْحَقِّ)** – (ey Məhəmməd)**, biz sənə bu Quranı haqq olaraq nazil etdik ki, (لِتَحْكُمَ بَيْنَ النَّاسِ بِمَآ اَرٰيكَ اللّٰهُ ۜ) - Allah-Təalanın sənə vəhy edib bildirdiyi ilə xalqın arasında hökm edəsən. (وَلَا تَكُنْ لِلْخَآئِنِينَ خَصِيمًا ۙ)** – (ey Məhəmməd)**, günahkar şəxslərdən ötrü günahsız şəxslərlə mübahisə və münaqişə etmə,** (Tumə və onun qövmündən ötrü günahsız yəhudilərlə münaqişə etmə)**.**

**106) (وَاسْتَغْفِرِ اللّٰهَ ۜ اِنَّ اللّٰهَ كَانَ غَفُورًا رَحِيمًا ۚ)** – (ey Məhəmməd)**, niyyət etmişdin ki, günahsız yəhudini cəzalandırasan, Allah-Təaladan bağışlanmanı istə ki, Allah-Təala da səni bağışlasın. Həqiqətən, Allah-Təala tövbə edən şəxsləri bağışlayıb rəhm edəndir.** (Hansı dinin qanunu islam dininin qanunu kimidir və hansı din və qanunda islamda olduğu kimi ədalətə riayət olunur? Baxın ki, bir nəfər yəhudidən ötrü peyğəmbərə və müsəlmanlara nə qədər məzəmmət edilir?).

**107) (وَلَا تُجَادِلْ عَنِ الَّذِينَ يَخْتَانُونَ اَنْفُسَهُمْ)** – (ey Məhəmməd)**, özlərinə xəyanət edən şəxslərin** (Tumə və onun qövmünün) **əvəzində günahsız yəhudilərlə mübahisə və münaqişə etmə. (اِنَّ اللّٰهَ لَا يُحِبُّ مَنْ كَانَ خَوَّانًا اَثِيمًا ۙ) - həqiqətən, Allah-Təala xəyanətkar və günahkar olan şəxsləri sevməz.** (Tumə və onun kimi şəxslər bir neçə dəfə xəyanət və günah etməsəydi, Allah-Təala onu rüsvay etməz, Allah-Təala bir dəfə, iki dəfə, bəndəsinin əməlinə pərdə çəkər, elə ki həddi aşdı, o zaman Allah-Təala onun pərdəsini götürüb onun fasiq olduğunu aşkar edər. Asi şəxs, gərək, Allah-Təalanı düşünüb, əməlindən tövbə etsin ki, Allah-Təala da onu qəfil bəlaya düçar etməsin).

**108) (يَسْتَخْفُونَ مِنَ النَّاسِ وَلَا يَسْتَخْفُونَ مِنَ اللّٰهِ وَهُوَ مَعَهُمْ)** - (Tumə) **və onun qövmü həya edib öz əməllərini xalqdan gizlədir, amma Allah-Təaladan həya etməyib gizlətmirlər, halbuki Allah-Təala onlarla birlikdədir və onların halından agahdır. (اِذْ يُبَيِّتُونَ مَا لَا يَرْضٰى مِنَ الْقَوْلِ) - onlar Allah-Təaladan həya etməyib gecə vaxtı bir yerə toplanıb elə sözlər düzəldirdilər ki, Allah-Təala ona razı deyil.** (Ta ki o sözlərlə Tuməni xilas edib yəhudini günahkar etsinlər)**. (وَكَانَ اللّٰهُ بِمَا يَعْمَلُونَ مُحِيطًا) - Allah-Təala onların etdiyi hər bir əməldən agah olub və ehtiva edibdir.**

**109) (هَآ اَنْتُمْ هٰؤُلَآءِ جَادَلْتُمْ عَنْهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا) - (bəzi möminlər Tuməyə və onun qövmünə kömək edirdilər. Bu ayə möminlərə xitabdır), buyurur:**

فَمَنْ يُجَادِلُ اللّٰهَ عَنْهُمْ يَوْمَ الْقِيٰمَةِ اَمْ مَنْ يَكُونُ عَلَيْهِمْ وَكِيلًا ﴿١٠٩﴾ وَمَنْ يَعْمَلْ سُوٓءًا اَوْ يَظْلِمْ
نَفْسَهُ ثُمَّ يَسْتَغْفِرِ اللّٰهَ يَجِدِ اللّٰهَ غَفُورًا رَحِيمًا ﴿١١٠﴾ وَمَنْ يَكْسِبْ اِثْمًا فَاِنَّمَا يَكْسِبُهُ عَلٰى نَفْسِهِ
وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًا ﴿١١١﴾ وَمَنْ يَكْسِبْ خَطِيٓئَةً اَوْ اِثْمًا ثُمَّ يَرْمِ بِهِ بَرِيٓئًا فَقَدِ احْتَمَلَ بُهْتَانًا
وَاِثْمًا مُبِينًا ﴿١١٢﴾ وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكَ وَرَحْمَتُهُ لَهَمَّتْ طَٓائِفَةٌ مِنْهُمْ اَنْ يُضِلُّوكَ وَمَا يُضِلُّونَ
اِلَّا اَنْفُسَهُمْ وَمَا يَضُرُّونَكَ مِنْ شَيْءٍ

---

**“Ey möminlər, siz ki Tuməyə və onun qövmünə bu dünyada kömək edib onların əvəzində yəhudilərlə münaqişə və mübahisə etdiniz, (فَمَنْ يُجَادِلُ اللّٰهَ عَنْهُمْ يَوْمَ الْقِيٰمَةِ) - bəs qiyamət günündə onların əvəzinə sizdən kim mübahisə və münaqişə edəcək? (اَمْ مَنْ يَكُونُ عَلَيْهِمْ وَكِيلًا) – ya da kim onlara vəkil olub Allah-Təalanın əzabından onları qoruyacaq?** (Bu məzəmmətlər sadəcə Tuməyə kömək edən şəxslərə aid deyil, kim zalıma və haqsıza kömək etsə, bu məzəmmət və əzab ona da aiddir, islamda müsəlman, ya qeyri-müsəlman heç bir şəxsə zülm rəva deyil. Görün bir nəfər yəhudi səbəbinə Allah-Təala öz peyğəmbərinə necə məzəmmət edir və necə şiddətli hökmlər buyurur).

**110) (وَمَنْ يَعْمَلْ سُوٓءًا اَوْ يَظْلِمْ نَفْسَهُ ثُمَّ يَسْتَغْفِرِ اللّٰهَ يَجِدِ اللّٰهَ غَفُورًا رَحِيمًا) - (bu ayə günahkar şəxsə tövbə edərsə, tövbəsinin qəbul olunacağı vədini verir), buyurur: kim zərəri başqasına dəyən bir günah (məsələn, oğurluq) etsə, ya da özünə zülm və zərər edib, bir günah etsə, (məsələn, şərab içsə), ondan sonra bu günahlardan bağışlanmasını diləyib, tövbə etsə, Allah-Təalanın rəhm edib bağışlayan olduğunu görər. Tövbə edən şəxs heç vaxt Allah-Təala rəhmətindən naümid olmaz.**

**111) (وَمَنْ يَكْسِبْ اِثْمًا فَاِنَّمَا يَكْسِبُهُ عَلٰى نَفْسِهِ وَكَانَ اللّٰهُ عَلِيمًا حَكِيمًا) - kim dünyada günah etsə, həqiqətən, o günahı özünün zərərinə qazanıbdır. Axirətdə cəzası özünə yetişəcəkdir. Allah-Təala hər kəsin əməlindən agahdır və hər bir hökmü hikmət üzrə verər.**

**112) (وَمَنْ يَكْسِبْ خَطِيٓئَةً اَوْ اِثْمًا ثُمَّ يَرْمِ بِهِ بَرِيٓئًا فَقَدِ احْتَمَلَ بُهْتَانًا وَاِثْمًا مُبِينًا) – kim kiçik, ya da böyük günah edib, ondan sonra o günahı bir günahsız şəxsə isnad etsə,** (Necə ki Tumə yəhudiyə isnad etdi)**, belə şəxs həqiqətən, insanı heyrətdə qoyan böhtanı və aşkar bir günahı özünə yük edibdir. O yükün altından xilas ola bilməyəcəkdir.**

**113) (وَلَوْلَا فَضْلُ اللّٰهِ عَلَيْكَ وَرَحْمَتُهُ لَهَمَّتْ طَٓائِفَةٌ مِنْهُمْ اَنْ يُضِلُّوكَ) –** (ey Məhəmməd), **əgər Allah-Təalanın sənə lütf və mərhəməti olmasaydı və səni o oğurluğun həqiqətinə agah etməsəydi, bir tayfa** (bəni-Zəfər - Tumənin qövmü) **niyyət etmişdi ki, səni haqq və ədalət yolundan kənar salsın. O vaxt da yəhudiyə zülm edilərdi, halbuki onlar özləri bilirdilər ki, oğru Tumədir.**

وَاَنْزَلَ اللّٰهُ عَلَيْكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَعَلَّمَكَ مَا لَمْ تَكُنْ تَعْلَمُۜ وَكَانَ فَضْلُ اللّٰهِ عَلَيْكَ عَظِيمًا ﴿١١٣﴾
لَا خَيْرَ فٖي كَثٖيرٍ مِنْ نَجْوٰيهُمْ اِلَّا مَنْ اَمَرَ بِصَدَقَةٍ اَوْ مَعْرُوفٍ اَوْ اِصْلَاحٍ بَيْنَ النَّاسِۜ وَمَنْ يَفْعَلْ
ذٰلِكَ ابْتِغَٓاءَ مَرْضَاتِ اللّٰهِ فَسَوْفَ نُؤْتٖيهِ اَجْرًا عَظٖيمًا﴿١١٤﴾ وَمَنْ يُشَاقِقِ الرَّسُولَ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُ
الْهُدٰى وَيَتَّبِعْ غَيْرَ سَبٖيلِ الْمُؤْمِنٖينَ نُوَلِّهٖ مَا تَوَلّٰى وَنُصْلِهٖ جَهَنَّمَۜ وَسَٓاءَتْ مَصٖيرًا ﴿١١٥﴾

---

(وَمَا يُضِلُّونَ اِلَّا اَنْفُسَهُمْ وَمَا يَضُرُّونَكَ مِنْ شَيْءٍ) – (ey Məhəmməd)**, onlar özlərindən başqasını zəlalətə salmazlar, Tuməyə kömək etməyin günahı onlara aiddir. Heç bir şey ilə onlar sənə zərər yetirə bilməzlər. Allah-Təala səni mühafizə edib hər hökmü sənə yetirər. (**وَاَنْزَلَ اللّٰهُ عَلَيْكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَعَلَّمَكَ مَا لَمْ تَكُنْ تَعْلَمُ**) - Allah-Təala sənə Quranı və hikmətlə hökm etmək xüsusiyyətini nazil edib, bilmədiyin ehkamları da sənə öyrətdi. (**وَكَانَ فَضْلُ اللّٰهِ عَلَيْكَ عَظِيمًا**)** – (ey Məhəmməd)**, Allah-Təalanın sənə olan lütf və mərhəməti çox böyük mərtəbədədir. Allah-Təala hadisənin həqiqətini sənə bildirib yəhudiyə zülm etməkdən səni qorudu.**

**114) (**لَا خَيْرَ فٖي كَثٖيرٍ مِنْ نَجْوٰيهُمْ اِلَّا مَنْ اَمَرَ بِصَدَقَةٍ اَوْ مَعْرُوفٍ اَوْ اِصْلَاحٍ بَيْنَ النَّاسِ**) - bu** (Tumənin) **qövmü ki, yığılıb bir-biriylə gizlin danışırlar, onların gizlin danışmağında heç bir xeyir yoxdur, ancaq o şəxsə xeyir olar ki, gizlin danışanda sədəqə verməyi, ya da Allaha itaəti, ya da insanların arasını islah etməyi,** (iki şəxsin bir-biriylə ədavətləri olsa, onların arasını islah etməyi) **əmr edər.** (Hz. Peyğəmbər buyurdu: "Bəs sizə elə bir əməli xəbər verim ki, o, orucdan, namazdan və sədəqədən daha yaxşı olsun". Dedilər: "Bəli, ey peyğəmbər". Buyurdu: "İki nəfər ədavətli şəxsin arasını islah etmək" (Buxari, Sülh 1-11; Əbu Davud, Sünən, Ədəb 50)). **(**وَمَنْ يَفْعَلْ ذٰلِكَ ابْتِغَٓاءَ مَرْضَاتِ اللّٰهِ**) - kim bu qeyd olunan əməlləri Allah-Təalanın məmnunluğundan ötrü əmələ gətirsə, (**فَسَوْفَ نُؤْتٖيهِ اَجْرًا عَظٖيمًا**) - əlbəttə, axirətdə o şəxsə böyük əcr və savab verərik.**

**115) (**وَمَنْ يُشَاقِقِ الرَّسُولَ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُ الْهُدٰى**) -** (bu ayə (Tumə) **və onun kimi şəxslərin haqqındadır). Ayədə buyurulur: kim hidayət və islam dininin haqq olması ona aşkar olandan sonra peyğəmbərə müxalif olub tövhid və imandan vaz keçsə, (**وَيَتَّبِعْ غَيْرَ سَبٖيلِ الْمُؤْمِنٖينَ**) - möminlərdən başqasının yoluna** (müşriklərə) **tabe olsa, (**نُوَلِّهٖ مَا تَوَلّٰى وَنُصْلِهٖ جَهَنَّمَ وَسَٓاءَتْ مَصٖيرًا**) - o vaxt onu o istədiyi şeyə həvalə edib, ona həmişəlik cəhənnəmdə yer verərik, cəhənnəm nə pis bir məkan və dönüləcək bir yerdir.** (elə ki Tumənin oğurluğu sabit oldu, Mədinədən qaçıb Məkkəyə getdi, mürtəd olub bütpərəst oldu. Çünki onun adəti oğurluq idi. Necə ki deyirlər: adəti tərk etmək imkansızdır. Bir gecə yenə öz adəti üzrə oğurluğa gedib divarın altından keçmək üçün deşik açarkən, divar aşdı, o da altında qalıb həlak oldu. Tumə barəsində varid olan ayələrə diqqət olunsun, oğurluq, yalan danışmaq, böhtan, zülm və bu növ xəbis olan xüsusiyyətlərin hamısının qəbahəti o ayələrdən zahir və aşkardır.

اِنَّ اللّٰهَ لَا يَغْفِرُ اَنْ يُشْرَكَ بِهٖ وَيَغْفِرُ مَا دُونَ ذٰلِكَ لِمَنْ يَشَٓاءُۜ وَمَنْ يُشْرِكْ بِاللّٰهِ فَقَدْ ضَلَّ ضَلَالًا
بَعٖيدًا ﴿١١٦﴾ اِنْ يَدْعُونَ مِنْ دُونِهٖٓ اِلَّٓا اِنَاثًاۚ وَاِنْ يَدْعُونَ اِلَّا شَيْطَانًا مَرٖيدًاۙ﴿١١٧﴾ لَعَنَهُ اللّٰهُۢ وَقَالَ
لَاَتَّخِذَنَّ مِنْ عِبَادِكَ نَصٖيبًا مَفْرُوضًاۙ ﴿١١٨﴾ وَلَاُضِلَّنَّهُمْ وَلَاُمَنِّيَنَّهُمْ وَلَاٰمُرَنَّهُمْ فَلَيُبَتِّكُنَّ اٰذَانَ الْاَنْعَامِ
وَلَاٰمُرَنَّهُمْ فَلَيُغَيِّرُنَّ خَلْقَ اللّٰهِۜ

---

Ancaq Tumənin qissəsi bir nümunədir, Allah-Təalanın məqsədi o hökmləri islam ümmətinə yetirib, onlardan ötrü qanun etməkdir).

**116) (اِنَّ اللّٰهَ لَا يَغْفِرُ اَنْ يُشْرَكَ بِهٖ) - həqiqətən, Allah-Təala ona şərik qoşulmasını bağışlamaz. (وَيَغْفِرُ مَا دُونَ ذٰلِكَ لِمَنْ يَشَٓاءُ) - şirkdən başqa günah edənlər istisna, özü kimi** (böyük günahdan tövbə edənləri) **istəsə, bağışlayar. (وَمَنْ يُشْرِكْ بِاللّٰهِ فَقَدْ ضَلَّ ضَلَالًا بَعٖيدًا) - kim Allah-Təalaya şərik qoşsa, həqiqətən, hidayət yolundan son dərəcə uzaq olubdur.**

**117) (اِنْ يَدْعُونَ مِنْ دُونِهٖٓ اِلَّٓا اِنَاثًاۚ) - müşriklər Allah-Təalanı qoyub, qadın adı verdikləri şeylərə** (Lat, Uzza, Mənata) **ibadət edirlər. (وَاِنْ يَدْعُونَ اِلَّا شَيْطَانًا مَرٖيدًاۙ) - əksinə, Allah-Təalanın itaətindən çıxan şeytana itaət edirlər** (bütə sitayiş etmək şeytana sitayiş etməkdir)**.**

**118) (لَعَنَهُ اللّٰهُۢ وَقَالَ لَاَتَّخِذَنَّ مِنْ عِبَادِكَ نَصٖيبًا مَفْرُوضًاۙ) - o şeytanın bir xüsusiyyəti budur ki, Allah-Təala ona lənət edib öz rəhmətindən onu kənar edibdir. İkinci xüsusiyyəti xalqı zəlalətə salmaqdır. Dedi: ilahi, sənin bəndələrini asi edib onlardan bir qismini mənə itaət etsinlər deyə özüm üçün təyin edəcəyəm.**

**119) (وَلَاُضِلَّنَّهُمْ وَلَاُمَنِّيَنَّهُمْ) - əlbəttə, sənin bəndələrini zəlalətə salıb haqq yolundan kənar edib, onları batil olan arzulara vadar edəcəyəm, hansı ki əsla o arzulara yetişə bilməzlər.** (Necə ki bizim zamanımızda bəziləri Hz. Nuhun ömrü qədər yaşamağı arzu edər və elə şeylər istəyər ki, əsla onlara yetişə bilməyəcəkdir. Şeytanın bu sözünün əsl məqsədi bizim zamanımızda zahir olubdur). **(وَلَاٰمُرَنَّهُمْ فَلَيُبَتِّكُنَّ اٰذَانَ الْاَنْعَامِ) - əlbəttə, sənin bəndələrinə əmr edərəm ki dəvənin qulaqlarını yarıb onu azad etsinlər. Bu etiqada inanarlar ki, bu əməl Allah-Təalaya yaxınlaşmağa səbəbdir.** (Məkkə əhli elə ki dəvə 5 dəfə doğandan sonra 5-ci erkək olsa, o dəvənin qulaqlarını yarıb ondan mənfəət əldə etməyi özlərinə haram sayıb, onu səhraya buraxardılar. O dəvənin adına "bəhirə" deyərdilər. Bunu özlərindən ötrü xeyir əməl hesab edib deyərdilər: "Allah-Təala buna əmr buyurubdur". Allah-Təala isə buyurur: bu şeytan əməlidir, bunda heç bir xeyir yoxdur). **(وَلَاٰمُرَنَّهُمْ فَلَيُغَيِّرُنَّ خَلْقَ اللّٰهِ) -** (yenə şeytan deyir:) **əlbəttə, sənin bəndələrinə əmr edərəm ki, Allah-Təalanın yaratdığı məxluqu dəyişdirsinlər.** (Ərəblər güclü dəvələri olanda müəyyən bir müddət onları işlədəndən sonra onun bir gözünü çıxarıb, ona

وَمَنْ يَتَّخِذِ الشَّيْطَانَ وَلِيًّا مِنْ دُونِ اللّٰهِ فَقَدْ خَسِرَ خُسْرَانًا مُبِينًاؕ ﴿١١٩﴾ يَعِدُهُمْ وَيُمَنّٖيهِمْؕ وَمَا يَعِدُهُمُ
الشَّيْطَانُ اِلَّا غُرُورًا ﴿١٢٠﴾ اُولٰٓئِكَ مَاْوٰيهُمْ جَهَنَّمُ وَلَا يَجِدُونَ عَنْهَا مَحِيصًا ﴿١٢١﴾ وَالَّذٖينَ
اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَنُدْخِلُهُمْ جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدٖينَ فٖيهَٓا اَبَدًاؕ وَعْدَ اللّٰهِ
حَقًّاؕ وَمَنْ اَصْدَقُ مِنَ اللّٰهِ قٖيلًا ﴿١٢٢﴾ لَيْسَ بِاَمَانِيِّكُمْ وَلَٓا اَمَانِيِّ اَهْلِ الْكِتَابِؕ مَنْ يَعْمَلْ سُوٓءًا
يُجْزَ بِهٖۙ وَلَا يَجِدْ لَهُ مِنْ دُونِ اللّٰهِ وَلِيًّا وَلَا نَصٖيرًا ﴿١٢٣﴾ وَمَنْ يَعْمَلْ مِنَ الصَّالِحَاتِ مِنْ ذَكَرٍ اَوْ
اُنْثٰى وَهُوَ مُؤْمِنٌ فَاُولٰٓئِكَ يَدْخُلُونَ الْجَنَّةَ وَلَا يُظْلَمُونَ نَقٖيرًا ﴿١٢٤﴾

---

minməyi haram sayardılar. İnsanı xacə etmək də bunun kimidir, bu ayə buna dəlildir ki, insanı xacə etmək haram və şeytan əməlidir). (وَمَنْ يَتَّخِذِ الشَّيْطَانَ وَلِيًّا مِنْ دُونِ اللّٰهِ) **- kim Allah-Təaladan başqa şeytanı özünə dost tutsa, (فَقَدْ خَسِرَ خُسْرَانًا مُبِينًا)- həqiqətən, o şəxs özünə açıq-aşkar ziyan edibdir.**

**120) (يَعِدُهُمْ وَيُمَنّٖيهِمْ) - şeytan onlara batil olan vədlər verib, batil arzulara vadar edər. (وَمَا يَعِدُهُمُ الشَّيْطَانُ اِلَّا غُرُورًا) -şeytan onları aldadıb Allah-Təaladan uzaqlaşdırmaqdan başqa vəd vermir.**

**121) (اُولٰٓئِكَ مَاْوٰيهُمْ جَهَنَّمُ وَلَا يَجِدُونَ عَنْهَا مَحِيصًا) - o şeytana tabe olanların məkanı cəhənnəmdir. Oradan xilas olub bir tərəfə qaçmağa yol tapmazlar.**

**122) (وَالَّذٖينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ سَنُدْخِلُهُمْ جَنَّاتٍ تَجْرٖي مِنْ تَحْتِهَا الْاَنْهَارُ خَالِدٖينَ فٖيهَٓا اَبَدًاؕ) - o şəxslər ki iman gətirib saleh əməl edirlər, əlbəttə, axirətdə onları ağaclarının və qəsrlərinin altından çaylar axan bağlara daxil edərik. Orada həmişəlik qalıb, çıxmayacaqlar. (وَعْدَ اللّٰهِ حَقًّاؕ وَمَنْ اَصْدَقُ مِنَ اللّٰهِ قٖيلًا) - cənnətə daxil olmaq vədi Allah-Təaladan möminlərə haqq olan vəddir. Allah-Təalanın sözündən daha doğru deyən kimdir?**

**123) (لَيْسَ بِاَمَانِيِّكُمْ وَلَٓا اَمَانِيِّ اَهْلِ الْكِتَابِؕ) - cənnətə daxil olmaq siz müsəlmanların arzusuyla və əhli-kitabın arzu etməsi ilə deyildir. (مَنْ يَعْمَلْ سُوٓءًا يُجْزَ بِهٖۙ) – kim pis əməl edib günahkar olsa, o əməlin cəzası ona veriləcəkdir. (وَلَا يَجِدْ لَهُ مِنْ دُونِ اللّٰهِ وَلِيًّا وَلَا نَصٖيرًا) - günahkar şəxs Allah-Təaladan başqa özünə nə sahib çıxan bir dost, nə də bir kömək edən tapmaz.**

**124) (وَمَنْ يَعْمَلْ مِنَ الصَّالِحَاتِ مِنْ ذَكَرٍ اَوْ اُنْثٰى وَهُوَ مُؤْمِنٌ) – kişi və ya qadın, mömin olduğu halda, kim saleh əməllər etsə, (فَاُولٰٓئِكَ يَدْخُلُونَ الْجَنَّةَ وَلَا يُظْلَمُونَ نَقٖيرًا) - belə əməl sahibləri cənnətə daxil olub, onlara zülm olunmayıb, əcr, savabları xurma çəyirdəyindəki tumurcuq qədər əskik olmaz. Ayədə islam dininin təməlinin iki şey olduğu bəyan olunur: birincisi - Allah-Təalaya etiqad etmək, ikincisi – saleh əməl etmək, bu iki şeyin biri bir şəxsdə olmasa, o şəxsin dini tamam deyil. Necə ki sıradakı ayədə buyurur).**

وَمَنْ اَحْسَنُ دِينًا مِمَّنْ اَسْلَمَ وَجْهَهُ لِلّٰهِ وَهُوَ مُحْسِنٌ وَاتَّبَعَ مِلَّةَ اِبْرٰهِيمَ حَنِيفًاۜ وَاتَّخَذَ اللّٰهُ اِبْرٰهِيمَ خَلِيلًا
﴿١٢٥﴾ وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ وَكَانَ اللّٰهُ بِكُلِّ شَيْءٍ مُحِيطًا۟ ﴿١٢٦﴾ وَيَسْتَفْتُونَكَ
فِي النِّسَاۤءِۜ قُلِ اللّٰهُ يُفْتِيكُمْ فِيهِنَّۙ وَمَا يُتْلٰى عَلَيْكُمْ فِي الْكِتَابِ فِي يَتَامَى النِّسَاۤءِ الّٰتِي لَا تُؤْتُونَهُنَّ مَا
كُتِبَ لَهُنَّ وَتَرْغَبُونَ اَنْ تَنْكِحُوهُنَّ وَالْمُسْتَضْعَفِينَ مِنَ الْوِلْدَانِۙ وَاَنْ تَقُومُوا لِلْيَتَامٰى بِالْقِسْطِۜ

---

**125) (وَمَنْ اَحْسَنُ دِينًا مِمَّنْ اَسْلَمَ وَجْهَهُ لِلّٰهِ وَهُوَ مُحْسِنٌ) – özünü Allah-Təalaya məxsus edib, Ona şərik qoşmayıb başqa məbud seçməyən, yaxşı və gözəl əməllər edən şəxsdən din olaraq gözəl olan kimdir? (وَاتَّبَعَ مِلَّةَ اِبْرٰهِيمَ حَنِيفًا) – həm də İbrahimin (ə.s) dininə** (bu din islamdır) **tabe olan,** (belə şəxsin dinindən yaxşı və gözəl din olmaz)**. (وَاتَّخَذَ اللّٰهُ اِبْرٰهِيمَ خَلِيلًا) - Allah-Təala İbrahimi özünə dost etmişdir.** (Allah-Təala bir şəxsi özünə dost etsə, onun dininə tabe olmaq lazımdır).

**126) (وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِۜ وَكَانَ اللّٰهُ بِكُلِّ شَيْءٍ مُحِيطًا۟) - səmalarda və yerdə olan məxluqatın hakimiyyəti Allah-Təalaya məxsusdur. Allah-Təala hər şeyi əhatə edib agah olandır.**

**127) (وَيَسْتَفْتُونَكَ فِي النِّسَاۤءِۜ) –** (ey Məhəmməd)**, yetim qadınların malı haqqında səndən fitva istəyirlər.** (Yetim qızları saxlayardılar, əgər gözəl olsaydı, onunla evlənib malına sahib olardılar, əgər gözəl olmasaydı, yenə malına sahib olub, onu heç kimlə evləndirməzdilər. Hz. Peyğəmbərin hüzuruna gəlib bu məsələni soruşdular. Allah-Təala onların sual və cavabını bu ayədə bəyan edir). **(قُلِ اللّٰهُ يُفْتِيكُمْ فِيهِنَّ) -,** (ey Məhəmməd)**, de ki, Allah-Təala onların haqqında sizə fitva verir. (وَمَا يُتْلٰى عَلَيْكُمْ فِي الْكِتَابِ فِي يَتَامَى النِّسَاۤءِ الّٰتِي لَا تُؤْتُونَهُنَّ مَا كُتِبَ لَهُنَّ) - o yetim qadınlar ki, onlara Allah-Təalanın vacib etdiyi haqlarını vermirsiniz, onların haqqındakı fitva bu Qurani-Şərifdə sizə oxunur, amma siz o fitvaya əməl etmirsiniz. (O fitva həmin bu surənin əvvəlindəki – "yetim qızlarla evlənən zaman onların haqqında ədalətli olmamaqdan əgər qorxsanız, belə vaxtda o yetim qızlarla evlənməyin. O yetim qızlardan başqa sizə halal olan qadınlarla evlənin" ayəsidir. Allah-Təala sizdən ötrü bu ayədə yetim qızların hökmünü qeyd edib buyurubdur: "Əgər yetim qızlarla evlənərkən onların mallarını idarə etməkdə ədalətli olmamaqdan qorxsanız, onları almayın, gedib başqa qadınlarla evlənin. Yetim qızları başqa şəxslərə ərə verin. Onların malına tamah salmayın". Budur onların hökmü, gərək, o hökmə əməl edəsiniz. (وَتَرْغَبُونَ اَنْ تَنْكِحُوهُنَّ) - amma siz istəyirsiniz ki, o yetim qızları alıb mallarına sahib olasınız, onların malını xərcləməyin. (وَالْمُسْتَضْعَفِينَ مِنَ الْوِلْدَانِۙ) – o malı xərcləməyib, yetkin olandan sonra onların özlərinə verərsiniz.** (Ərəblər atadan yetim qalan kiçik oğlan uşaqlarının malını xərcləyib, onlara miras verməzdilər), **(وَاَنْ تَقُومُوا لِلْيَتَامٰى بِالْقِسْطِ) - yenə Allah-Təala yetimlər haqqında, xüsusən, siz böyük**

وَمَا تَفْعَلُوا مِنْ خَيْرٍ فَاِنَّ اللّٰهَ كَانَ بِهٖ عَلٖيمًا ﴿١٢٧﴾ وَاِنِ امْرَاَةٌ خَافَتْ مِنْ بَعْلِهَا نُشُوزًا اَوْ اِعْرَاضًا
فَلَا جُنَاحَ عَلَيْهِمَٓا اَنْ يُصْلِحَا بَيْنَهُمَا صُلْحًاۜ وَالصُّلْحُ خَيْرٌ وَاُحْضِرَتِ الْاَنْفُسُ الشُّحَّ وَاِنْ تُحْسِنُوا
وَتَتَّقُوا فَاِنَّ اللّٰهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبٖيرًا ﴿١٢٨﴾ وَلَنْ تَسْتَطٖيعُوٓا اَنْ تَعْدِلُوا بَيْنَ النِّسَٓاءِ وَلَوْ حَرَصْتُمْ

---

**əmir və imam olan şəxslərə fitva verir. Siz əmirlər, imamlar və hakimlər, gərək, yetimlərin haqqında ədalətlə rəftar edib, mallarını mühafizə edib, gərək, vaxtında onlara verəsiniz. (**وَمَا تَفْعَلُوا مِنْ خَيْرٍ فَاِنَّ اللّٰهَ كَانَ بِهٖ عَلٖيمًا**) – nə xeyir əməl etsəniz, həqiqətən, Allah-Təala ondan agahdır, onun əvəzində sizə mükafat verəcəkdir.**

**128) (**وَاِنِ امْرَاَةٌ خَافَتْ مِنْ بَعْلِهَا نُشُوزًا اَوْ اِعْرَاضًا**) - əgər bir qadın ərinin ondan uzaq olub, xərcliyini verməməsindən, ya da ər-arvad arasında məhəbbət olmayıb ondan üz döndərməsindən, ya da ərinin onu vurub əziyyət etməyindən qorxsa,** (bu qeyd olunanlar kişinin qadından nifrət etməsi halıdır)**, elə ki bu nifrətin əlamətlərini qadın ərində görsə, (**فَلَا جُنَاحَ عَلَيْهِمَٓا اَنْ يُصْلِحَا بَيْنَهُمَا صُلْحًاۜ وَالصُّلْحُ خَيْرٌ**) - onlara öz aralarında bir növ barışmaqda heç bir günah yoxdur. Barışmaq boşanmaqdan yaxşıdır. (**وَاُحْضِرَتِ الْاَنْفُسُ الشُّحَّ**) - amma nəfslərdə həmişə var, ər-arvadın heç biri öz haqqından keçməz, amma vaz keçib barışmaq yaxşıdır. (Qadın gərək öz haqqından və mehriyyəsindən bir qədər, ya da tamam vaz keçsin, kişi də ona rəhm edib boşamasın. Qadının da kişiyə meyli olmayanda səbir* edib boşanmasın).**

*(****Qeyd:*** İmran ibn Hatan son dərəcə çirkin sifətli şəxs idi. Amma onun xanımı gözəl üzlü bir qadın idi. Bir gün qadın ərinə diqqətlə baxıb - "əlhəmdülillah," - dedi. İmran soruşdu: "Həmdin səbəbi nədir?" Qadın dedi: "Həmd edirəm Allah-Təalaya ki, mənimlə sən hər ikimiz cənnət əhliyik". İmran dedi: "Haradan məlum oldu?" Qadın dedi: "Ondan ötrü ki, Allah-Təala mənim kimi gözəl qadını sənə qismət edib, sən şükür edibsən, mənə də sənin kimi çirkin sifətli birini qismət edib, mən də səbir etmişəm. Allah-Təala səbir və şükür edən bəndələrinə cənnəti vəd edibdir". İmran dedi: "Doğru dedin". İmran ibn Hatanın əhvalatını təfsilatı ilə bilmək istəyən şəxs imam Əbül-Fərəc İsfəhaninin "Əğani" kitabına baxsın. Bu kişi xaricilərdəndir, qəribə və uzun hekayəsi var).*

**(**وَاِنْ تُحْسِنُوا وَتَتَّقُوا فَاِنَّ اللّٰهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبٖيرًا**) - əgər siz ərlər qadınlara yaxşılıq edib, Allah-Təaladan qorxub, qadınlara zülm etməsəniz, Allah-Təala sizə mükafat verər. Həqiqətən, Allah-Təala etdiyiniz hər bir şeydən xəbərdar olandır.**

**129) (**وَلَنْ تَسْتَطٖيعُوٓا اَنْ تَعْدِلُوا بَيْنَ النِّسَٓاءِ وَلَوْ حَرَصْتُمْ**) -** (bu ayənin hökmü birdən çox xanımı olan şəxslərə aiddir)**, əlbəttə, çox istəsəniz də, qadınlar arasında ədalətlə rəftar etməyə sizdə güc və qüdrət olmaz,** (iki qadının ikisinə də eyni dərəcədə məhəbbət bəsləmək insanın imkanı xaricindədir. Elə ki məhəbbət

فَلَا تَمِيلُوا كُلَّ الْمَيْلِ فَتَذَرُوهَا كَالْمُعَلَّقَةِ وَاِنْ تُصْلِحُوا وَتَتَّقُوا فَاِنَّ اللّٰهَ كَانَ غَفُورًا رَحِيمًا ﴿١٢٩﴾
وَاِنْ يَتَفَرَّقَا يُغْنِ اللّٰهُ كُلًّا مِنْ سَعَتِهِ وَكَانَ اللّٰهُ وَاسِعًا حَكِيمًا ﴿١٣٠﴾ وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي
الْاَرْضِ وَلَقَدْ وَصَّيْنَا الَّذِينَ اُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ وَاِيَّاكُمْ اَنِ اتَّقُوا اللّٰهَ وَاِنْ تَكْفُرُوا فَاِنَّ لِلّٰهِ مَا فِي
السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَكَانَ اللّٰهُ غَنِيًّا حَمِيدًا ﴿١٣١﴾

---

eyni olmadı, başqa şeylərdə də bərabərsizlik yaranar). **(فَلَا تَمِيلُوا كُلَّ الْمَيْلِ) – qadınlar arasında ədalətlə rəftar etməniz mümkün olmayanda, birinə çox meyil və məhəbbət edib, o birisindən tamamilə üz döndərməyin, (فَتَذَرُوهَا كَالْمُعَلَّقَةِ) – elə olmasın ki, onu asılı halda (nə ərli kimi, nə də ərsiz kimi) qoyasınız,** (bu, son dərəcə zülmdür. Əgər birinə məhəbbətiniz - hansı ki bu qəlbdən asılıdır, artıq da olsa, o birinin də vacib olan haqqına gərək riayət edəsiniz). **(وَاِنْ تُصْلِحُوا وَتَتَّقُوا فَاِنَّ اللّٰهَ كَانَ غَفُورًا رَحِيمًا) - əgər qadınlardan birinə qarşı istəksiz olub, zülm edəndən sonra Allah-Təaladan qorxub, tövbə edib o zülmü islah etsəniz,** (ya gözəl şəkildə saxlayıb, ya da yaxşı şəkildə boşasanız, daha ondan sonra birdən artıq qadın almayın. Bu surənin əvvəlində qeyd olunan birdən artıq arvad almanın şərtini (ədaləti) unutmayıb, çox arvad almayın). **Həqiqətən, Allah-Təala tövbə edən şəxsləri bağışlayıb onlara rəhm edəndir.**

**130) (وَاِنْ يَتَفَرَّقَا) - əgər kişi qadınla istəklə rəftar edə bilməyəndə onu boşayıb, bir-birilərindən ayrılsalar, o vaxt çox yaxşı, gözəl iş görmüş olarlar. (يُغْنِ اللّٰهُ كُلًّا مِنْ سَعَتِهِ) - Allah-Təala öz geniş lütfü və zənginliyi ilə onları bir-birindən ehtiyacsız edər, o qadına ondan yaxşı ər, ona da ondan yaxşı qadın qismət edər. (وَكَانَ اللّٰهُ وَاسِعًا حَكِيمًا) - Allah-Təala ehtiyacsız və qüdrət sahibidir. İnsanların arasında hikmətlə hökm edər.**

**131) (وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) - səmalarda və yerdə olan məxluqatın xaliqi, sahibi və ruzi verəni Allah-Təaladır, hər cür neməti onlara verən Allah-Təaladır. Belə Allah-Təala ibadət və itaət olunmağa layiqdir. (وَلَقَدْ وَصَّيْنَا الَّذِينَ اُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ وَاِيَّاكُمْ اَنِ اتَّقُوا اللّٰهَ)** – (ey Quran əhli), **həqiqətən, sizdən əvvəl əhli-kitaba öz peyğəmbərlərinin vasitəsilə və sizə öz peyğəmbərinizin vasitəsilə vəsiyyət etdik, gərək, o vəsiyyəti mühafizə edəsiniz. O vəsiyyət budur ki, Allah-Təaladan qorxub vacib əmrlərə əməl edib, haramdan kənar olasınız. (وَاِنْ تَكْفُرُوا فَاِنَّ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) - əgər siz kafir olub Allah-Təalaya itaət etməsəniz, həqiqətən, səmalarda və yerdə olan məxluqatın hakimiyyəti Allah-Təalaya məxsusdur. Allah-Təalanın qüdrətindən çıxa bilməzsiniz. (وَكَانَ اللّٰهُ غَنِيًّا حَمِيدًا) - bununla birlikdə, Allah-Təala məxluqatın özünə və ibadətinə möhtac olmayıb, həmd-səna edilməyə layiqdir.**

وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَكَفٰى بِاللّٰهِ وَكٖيلًا ﴿١٣٢﴾ اِنْ يَشَاْ يُذْهِبْكُمْ اَيُّهَا النَّاسُ وَيَاْتِ
بِاٰخَرٖينَ وَكَانَ اللّٰهُ عَلٰى ذٰلِكَ قَدٖيرًا ﴿١٣٣﴾ مَنْ كَانَ يُرٖيدُ ثَوَابَ الدُّنْيَا فَعِنْدَ اللّٰهِ ثَوَابُ الدُّنْيَا
وَالْاٰخِرَةِ وَكَانَ اللّٰهُ سَمٖيعًا بَصٖيرًا ﴿١٣٤﴾ يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا كُونُوا قَوَّامٖينَ بِالْقِسْطِ شُهَدَٓاءَ لِلّٰهِ
وَلَوْ عَلٰٓى اَنْفُسِكُمْ اَوِ الْوَالِدَيْنِ وَالْاَقْرَبٖينَ اِنْ يَكُنْ غَنِيًّا اَوْ فَقٖيرًا فَاللّٰهُ اَوْلٰى بِهِمَا فَلَا تَتَّبِعُوا الْهَوٰٓى
اَنْ تَعْدِلُوا وَاِنْ تَلْوُٓا اَوْ تُعْرِضُوا فَاِنَّ اللّٰهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبٖيرًا ﴿١٣٥﴾

---

**132) (وَلِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَكَفٰى بِاللّٰهِ وَكٖيلًا) - səmalarda və yerdə olan məxluqatın ixtiyarı və hakimiyyəti Allah-Təalaya məxsusdur. Əgər hər bir işinizi ona həvalə etsəniz, Allah-Təala sizə vəkil olduğu halda hər bir işinizi idarə etməyə kifayət edər,** (bu ayənin təkrarlanması bir daha təkid etməkdən ötrüdür ki, bütün məxluqatın ixtiyarı Allah-Təalanın qüdrəti altındadır. Heç bir şey onun qüdrətindən kənar olmaz).

**133) (اِنْ يَشَاْ يُذْهِبْكُمْ اَيُّهَا النَّاسُ وَيَاْتِ بِاٰخَرٖينَ) - ey insanlar, əgər Allah-Təala istəsə, sizi fani edib sizdən başqa elə bir məxluqatı dünyaya gətirər ki, ona ibadət etsinlər. (وَكَانَ اللّٰهُ عَلٰى ذٰلِكَ قَدٖيرًا) - Allah-Təala sizi fani edib, əvəzinizə başqa məxluq gətirməyə, əlbəttə, qadirdir.**

**134) (مَنْ كَانَ يُرٖيدُ ثَوَابَ الدُّنْيَا) - sizdən kim dünya savabını və əcrini istəyir,** (qənimətdən ötrü cihada gedən şəxs kimi), **(فَعِنْدَ اللّٰهِ ثَوَابُ الدُّنْيَا وَالْاٰخِرَةِ) - dünya və axirətin savab və əcri, hər ikisi Allah-Təalanın yanındadır. Nə olubdur o şəxsə ki, təkcə dünya əcrini istəyib axirət əcrini istəmir? (وَكَانَ اللّٰهُ سَمٖيعًا بَصٖيرًا) - Allah-Təala xalqın əməllərini, sözlərini eşidib görəndir.**

**135) ( يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا ) -** (bu ayə şahidlik etmək barəsindədir)**. Ey iman gətirən şəxslər, (كُونُوا قَوَّامٖينَ بِالْقِسْطِ شُهَدَٓاءَ لِلّٰهِ وَلَوْ عَلٰٓى اَنْفُسِكُمْ اَوِ الْوَالِدَيْنِ وَالْاَقْرَبٖينَ)- hərçənd o şahidlik özünüzün, ya da ata və ananızın, ya da qohum-əqrəbanızın zərərinə olsa da, cəhd edin ki, ədalətlə rəftar edib zalım olmayasınız, harda şahidlik lazım olsa, Allah-Təaladan ötrü doğruluqla** (necə ki Allah-Təala sizə doğru şahidlik etməyi əmr edir) **şahidlik edəsiniz, (اِنْ يَكُنْ غَنِيًّا اَوْ فَقٖيرًا فَاللّٰهُ اَوْلٰى بِهِمَا) - o şəxs ki onun zərərinə şahidlik edilir, əgər varlı olsa, onun zəngin olmağı sizə doğru şahidlik etməkdə mane olmasın, onun məmnunluğunu gözləyib şahidliyi gizlətməyin. Ya əgər kasıb olsa, onun yoxsulluğuna rəhm edib şahidliyi gizlətməyin. Allah-Təala onlara sizdən yaxındır. Əgər onların yoxsul, ya da zəngin olması nəzərə alınsa, Allah-Təala sizə şahidlik etməyi əmr etməz. (فَلَا تَتَّبِعُوا الْهَوٰٓى اَنْ تَعْدِلُوا) – nəfsani arzulara tabe olub haqdan keçib ədaləti tərk etməyin. (وَاِنْ تَلْوُٓا اَوْ تُعْرِضُوا فَاِنَّ اللّٰهَ كَانَ بِمَا تَعْمَلُونَ خَبٖيرًا)- əgər şahidlik vaxtı dilinizi haqdan batil tərəfinə çevirsəniz, ya da bildiyiniz bir şeydə doğru şahidlik etməyib üz**

يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ وَالْكِتَابِ الَّذِي نَزَّلَ عَلٰى رَسُولِهِ وَالْكِتَابِ الَّذِيٓ اَنْزَلَ مِنْ قَبْلُ
وَمَنْ يَكْفُرْ بِاللّٰهِ وَمَلٰٓئِكَتِهِ وَكُتُبِهِ وَرُسُلِهِ وَالْيَوْمِ الْاٰخِرِ فَقَدْ ضَلَّ ضَلَالًا بَعِيدًا ﴿١٣٦﴾ اِنَّ الَّذِينَ اٰمَنُوا
ثُمَّ كَفَرُوا ثُمَّ اٰمَنُوا ثُمَّ كَفَرُوا ثُمَّ ازْدَادُوا كُفْرًا لَمْ يَكُنِ اللّٰهُ لِيَغْفِرَ لَهُمْ وَلَا لِيَهْدِيَهُمْ سَبِيلًا ﴿١٣٧﴾
بَشِّرِ الْمُنَافِقِينَ بِاَنَّ لَهُمْ عَذَابًا اَلِيمًا ﴿١٣٨﴾ اَلَّذِينَ يَتَّخِذُونَ الْكَافِرِينَ اَوْلِيَآءَ مِنْ دُونِ الْمُؤْمِنِينَ
اَيَبْتَغُونَ عِنْدَهُمُ الْعِزَّةَ فَاِنَّ الْعِزَّةَ لِلّٰهِ جَمِيعًا ﴿١٣٩﴾ وَقَدْ نَزَّلَ عَلَيْكُمْ فِي الْكِتَابِ اَنْ اِذَا سَمِعْتُمْ
اٰيَاتِ اللّٰهِ يُكْفَرُ بِهَا وَيُسْتَهْزَاُ بِهَا

---

**döndərsəniz, həqiqətən, Allah-Təala hər bir əməlinizə xəbərdar olub şahidliyi gizlətməyin cəzasını sizə verəcəkdir.**

**136)** (يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوٓا اٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ وَالْكِتَابِ الَّذِي نَزَّلَ عَلٰى رَسُولِهِ) **- ey iman gətirənlər, Allah-Təalaya və onun peyğəmbərinə göndərdiyi kitaba** (Qurana) **iman gətirməkdə sabitqədəm olub möhkəm durun.** (وَالْكِتَابِ الَّذِيٓ اَنْزَلَ مِنْ قَبْلُ) **- yenə o kitablara** (Tövrat və İncil) **iman gətirməkdə möhkəm olun ki, Allah-Təala o kitabları bundan qabaq keçən peyğəmbərlərə göndəribdir.** (وَمَنْ يَكْفُرْ بِاللّٰهِ وَمَلٰٓئِكَتِهِ وَكُتُبِهِ وَرُسُلِهِ وَالْيَوْمِ الْاٰخِرِ فَقَدْ ضَلَّ ضَلَالًا بَعِيدًا) **– kim Allah-Təalanı və onun mələklərini, kitablarını, peyğəmbərlərini və axirət gününü inkar etsə, həqiqətən, o şəxs Haqq yolundan çox uzaq düşüb, azıbdır.**

**137)** (اِنَّ الَّذِينَ اٰمَنُوا ثُمَّ كَفَرُوا) – **həqiqətən, o şəxslər ki mənə və Qurana iman gətirib ondan sonra kafir olar,** (ثُمَّ اٰمَنُوا ثُمَّ كَفَرُوا ثُمَّ ازْدَادُوا كُفْرًا) – **ondan sonra yenə iman gətirib imandan sonra yenə kafir olar, kafir olandan sonra küfrlərində qalar,** (ləm yəkunillahu li yəğfirə ləhum və la yəhdiyəhum səbilən) (لَمْ يَكُنِ اللّٰهُ لِيَغْفِرَ لَهُمْ وَلَا لِيَهْدِيَهُمْ سَبِيلًا) **- Allah-Təala belə şəxsləri bağışlayıb haqq yoluna hidayət edən deyildir.**

**138)** (بَشِّرِ الْمُنَافِقِينَ بِاَنَّ لَهُمْ عَذَابًا اَلِيمًا) – (ey Məhəmməd), **münafiqlərə müjdə ver ki, onlardan ötrü axirətdə şiddətli əzab vardır.**

**139)** (اَلَّذِينَ يَتَّخِذُونَ الْكَافِرِينَ اَوْلِيَآءَ مِنْ دُونِ الْمُؤْمِنِينَ) – **münafiqlər o şəxslərdir ki, möminləri dost tutmayıb, özlərindən ötrü möminlərdən başqa kafir və müşrikləri dost tuturlar.** (اَيَبْتَغُونَ عِنْدَهُمُ الْعِزَّةَ) **– bəs münafiqlərin kafir və müşrikləri dost tutmaqda məqsədi onların yanında izzətli və hörmətli olmaqdır? Əgər belədirsə, onlarda heç bir izzət yoxdur.** (فَاِنَّ الْعِزَّةَ لِلّٰهِ جَمِيعًا) **– həqiqətən, izzət və qalibiyyətin hamısı Allah-Təalaya məxsusdur. Kimi istəsə, izzətli edər** (Necə ki möminlərə kömək olub, müşriklərə qalib oldular).

**140)** (وَقَدْ نَزَّلَ عَلَيْكُمْ فِي الْكِتَابِ) – **həqiqətən, siz müsəlmanlar Məkkədə olanda Allah-Təala bu Quranda sizə bunu nazil etdi ki,** (ən iza səmitum ayatillahi yukfəru biha və yəstəhzəu biha) (اَنْ اِذَا سَمِعْتُمْ اٰيَاتِ اللّٰهِ يُكْفَرُ بِهَا وَيُسْتَهْزَاُ بِهَا) **– nə zaman siz müşriklərin Allah-Təalanın ayələrini inkar edib istehza**

فَلَا تَقْعُدُوا مَعَهُمْ حَتّٰى يَخُوضُوا فٖي حَدٖيثٍ غَيْرِهٖۘ اِنَّكُمْ اِذًا مِثْلُهُمْ ۜ اِنَّ اللّٰهَ جَامِعُ الْمُنَافِقٖينَ وَالْكَافِرٖينَ فٖي جَهَنَّمَ جَمٖيعًاۙ ﴿١٤٠﴾ اَلَّذٖينَ يَتَرَبَّصُونَ بِكُمْۚ فَاِنْ كَانَ لَكُمْ فَتْحٌ مِنَ اللّٰهِ قَالُوٓا اَلَمْ نَكُنْ مَعَكُمْۘ وَاِنْ كَانَ لِلْكَافِرٖينَ نَصٖيبٌۙ قَالُوٓا اَلَمْ نَسْتَحْوِذْ عَلَيْكُمْ وَنَمْنَعْكُمْ مِنَ الْمُؤْمِنٖينَ ۜ فَاللّٰهُ يَحْكُمُ بَيْنَكُمْ يَوْمَ الْقِيٰمَةِ ۜ وَلَنْ يَجْعَلَ اللّٰهُ لِلْكَافِرٖينَ عَلَى الْمُؤْمِنٖينَ سَبٖيلًا۟ ﴿١٤١﴾ اِنَّ الْمُنَافِقٖينَ يُخَادِعُونَ اللّٰهَ وَهُوَ خَادِعُهُمْۚ

---

**etdiyini eşitsəniz,** (فَلَا تَقْعُدُوا مَعَهُمْ حَتّٰى يَخُوضُوا فٖي حَدٖيثٍ غَيْرِهٖۘ) – **Qurandan başqa söz danışana qədər onlarla bir yerdə əyləşməyin.** ( اِنَّكُمْ اِذًا مِثْلُهُمْ ) – **siz onlarla oturub danışan zaman onların Qurana istehza etmələrinə bais olursunuz, həqiqətən, o vaxt siz də onlar kimi olursunuz. Onlardan kənar olun ki, onların küfrü sizi tutmasın, bu hökmü sizə Məkkədə bu ayədə "Ayələrimizi istehza edənləri gördüyün zaman onlar söhbəti dəyişənə qədər onlardan üz çevir..."** (Ənam, 68) **göndərdik. İndiki siz Mədinədəsiniz, Mədinədə də Məkkə əhli kimi kafirlər Qurana istehza edən vaxt bir yerdə onlarla əyləşməyin ki, onlar Qurana istehza etməsinlər.** (اِنَّ اللّٰهَ جَامِعُ الْمُنَافِقٖينَ وَالْكَافِرٖينَ فٖي جَهَنَّمَ جَمٖيعًاۙ) – **həqiqətən, Allah-Təala münafiqlərin və kafirlərin hamısını cəhənnəmdə bir yerə toplayıb, onlara əzab edəcəkdir.**

**141)** ( اَلَّذٖينَ يَتَرَبَّصُونَ بِكُمْ) – (ey Məhəmməd), **münafiqlər elə şəxslərdir ki, baxıb siz müsəlmanları gözləyirlər, görək sizin müşriklərlə işiniz necə olur, qalib olursunuz, yoxsa məğlub?** (فَاِنْ كَانَ لَكُمْ فَتْحٌ مِنَ اللّٰهِ) – **əgər sizə Allah-Təala tərəfindən zəfər gəlib, müşriklərə qalib olsanız,** (قَالُوٓا اَلَمْ نَكُنْ مَعَكُمْ) – **o vaxt sizə deyərlər: "Bəs biz sizinlə birlikdə deyildik? Sizdən aralanıb müşriklərə tərəf getməmişik. Bizə də qənimətdən bir hissə verin".** (وَاِنْ كَانَ لِلْكَافِرٖينَ نَصٖيبٌ) – **əgər savaşda zəfər kafirlərə qismət olub sizə qalib gəlsələr,** (قَالُوٓا اَلَمْ نَسْتَحْوِذْ عَلَيْكُمْ وَنَمْنَعْكُمْ مِنَ الْمُؤْمِنٖينَ) – **o vaxt da münafiqlər kafirlərə deyərlər: "Biz möminlərlə birlikdə sizə qalib olan vaxt möminlər istəyirdilər ki, sizi tamamən qətlə yetirsinlər. Bəs biz sizi mühafizə edib, onların sizi qətlə yetirmələrinə mane olmadıqmı? İndi siz qalib oldunuz, gərək bizə də qənimətdən bir hissə verəsiniz".** (فَاللّٰهُ يَحْكُمُ بَيْنَكُمْ يَوْمَ الْقِيٰمَةِ) – **Allah-Təala siz möminlərlə münafiqlər arasında qiyamət günündə hökm edər.** (وَلَنْ يَجْعَلَ اللّٰهُ لِلْكَافِرٖينَ عَلَى الْمُؤْمِنٖينَ سَبٖيلًا۟) – **Allah-Təala qiyamət günündə heç vaxt kafirləri möminlərə hakim və böyük etməyəcəkdir. Ola bilər ki, dünyada kafirlər möminlərə hakim olsunlar. Amma qiyamət günündə hakimiyyət möminlərə məxsusdur. Kafirlərin və münafiqlərin onlara heç bir hakimiyyəti olmaz.**

**142)** (اِنَّ الْمُنَافِقٖينَ يُخَادِعُونَ اللّٰهَ وَهُوَ خَادِعُهُمْ) – **münafiqlər, həqiqətən, Allah-Təalaya hiylə edib, iman izharı edib küfrlərini gizlədirlər, Allah-Təala**

وَاِذَا قَامُوٓا اِلَى الصَّلٰوةِ قَامُوا كُسَالٰى يُرَآؤُنَ النَّاسَ وَلَا يَذْكُرُونَ اللّٰهَ اِلَّا قَلِيلًا ﴿١٤٢﴾ مُذَبْذَبِينَ بَيْنَ
ذٰلِكَ لَآ اِلٰى هٰٓؤُلَآءِ وَلَآ اِلٰى هٰٓؤُلَآءِ وَمَنْ يُضْلِلِ اللّٰهُ فَلَنْ تَجِدَ لَهُ سَبِيلًا ﴿١٤٣﴾ يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا
لَا تَتَّخِذُوا الْكَافِرِينَ اَوْلِيَآءَ مِنْ دُونِ الْمُؤْمِنِينَ اَتُرِيدُونَ اَنْ تَجْعَلُوا لِلّٰهِ عَلَيْكُمْ سُلْطَانًا مُبِينًا ﴿١٤٤﴾
اِنَّ الْمُنَافِقِينَ فِي الدَّرْكِ الْاَسْفَلِ مِنَ النَّارِ وَلَنْ تَجِدَ لَهُمْ نَصِيرًا ﴿١٤٥﴾

---

**da əməllərinin müqabilində onlarla hiyləgər kimi rəftar edər,** (dünyada münafiqlərin mallarını, qanlarını mühafizə etməyi əmr edib , amma axirətdə cəhənnəmin ən alt təbəqəsini onlardan ötrü hazır edibdir). **(وَاِذَا قَامُوٓا اِلَى الصَّلٰوةِ) (قَامُوا كُسَالٰى) – münafiqlərin xüsusiyyətlərindən biri budur ki, namaza duran vaxt tənbəllik və süst halətində durarlar. Namaza istəkləri olmadığı üçün namazda tənbəl olarlar. (يُرَآؤُنَ النَّاسَ وَلَا يَذْكُرُونَ اللّٰهَ اِلَّا قَلِيلًا) – namazda məqsədləri özlərini xalqa göstərmək olar, Allah-Təalanı az zikr edib namaz qılarlar, amma xəlvətdə heç vaxt namaz qılmazlar,** (məxluq gərək heç vaxt Xaliqindən qafil olmasın, öldürən, dirildən Allah-Təala, gərək, həmişə diqqət mərkəzində olsun).

**143) (مُذَبْذَبِينَ بَيْنَ ذٰلِكَ)** – (ey Məhəmməd)**, münafiqlərin xüsusiyyətlərindən biri odur ki, küfrlə iman arasında çaşqın qalıblar. (لَآ اِلٰى هٰٓؤُلَآءِ) – nə tamamilə möminlərin tərəfindədirlər ki, mömin olsunlar, (وَلَآ اِلٰى هٰٓؤُلَآءِ) – və nə də açıqca müşriklərin tərəfindədirlər ki, müşrik olsunlar, (وَمَنْ يُضْلِلِ اللّٰهُ فَلَنْ تَجِدَ لَهُ سَبِيلًا)** – (ey Məhəmməd)**, Allah-Təala kimi öz əməlinin səbəbinə zəlalətə salsa, əlbəttə, sən ondan ötrü bir hidayət yolu tapa bilməzsən ki, onu zəlalətdən xilas edəsən.**

**144) ( يَآ اَيُّهَا الَّذِينَ اٰمَنُوا ) – ey iman gətirən şəxslər, (لَا تَتَّخِذُوا الْكَافِرِينَ اَوْلِيَآءَ مِنْ دُونِ الْمُؤْمِنِينَ) – möminlərdən başqasını - kafir və müşrikləri özünüzə dost tutmayın,** (Necə ki münafiqlər edirlər). **(اَتُرِيدُونَ اَنْ تَجْعَلُوا لِلّٰهِ عَلَيْكُمْ سُلْطَانًا مُبِينًا) – bəs siz möminlərin müşrikləri dost tutmaqda məqsədiniz odur ki, öz əleyhinizə Allah-Təalaya münafiq olmağınıza aşkar olan dəlil və sübut verəsiniz?** (Müşriklərlə dostluq etmək nifaq əlaməti olduğuna görə, siz də münafiq olarsınız).

**145) (اِنَّ الْمُنَافِقِينَ فِي الدَّرْكِ الْاَسْفَلِ مِنَ النَّارِ) – həqiqətən, münafiqlərin axirətdəki məskəni cəhənnəmin axırıncı təbəqəsindədir ki, cəhənnəmin bütün təbəqələrindən çox orada əzab var. (وَلَنْ تَجِدَ لَهُمْ نَصِيرًا)** – (ey Məhəmməd)**, heç vaxt münafiqlərə bir kömək edən tapmazsan ki, onları əzabdan xilas etsin. Həmişəlik əzabda qalacaqlar. (münafiqin əzabı kafir və müşriklərdən artıq və şiddətli olar. O cəhətə görə ki, münafiqin küfrdən əlavə müsəlmanlığını izhar etməkdə məqsədi ona istehza etməkdir. Amma kafir və müşrikdə belə xüsusiyyət yoxdur).**

اِلَّا الَّذِينَ تَابُوا وَاَصْلَحُوا وَاعْتَصَمُوا بِاللّٰهِ وَاَخْلَصُوا دِينَهُمْ لِلّٰهِ فَاُولٰٓئِكَ مَعَ الْمُؤْمِنِينَۜ وَسَوْفَ يُؤْتِ اللّٰهُ الْمُؤْمِنِينَ اَجْرًا عَظِيمًا ﴿١٤٦﴾ مَا يَفْعَلُ اللّٰهُ بِعَذَابِكُمْ اِنْ شَكَرْتُمْ وَاٰمَنْتُمْۜ وَكَانَ اللّٰهُ شَاكِرًا عَلِيمًا﴿١٤٧﴾ لَا يُحِبُّ اللّٰهُ الْجَهْرَ بِالسُّوٓءِ مِنَ الْقَوْلِ اِلَّا مَنْ ظُلِمَۜ وَكَانَ اللّٰهُ سَمِيعًا عَلِيمًا ﴿١٤٨﴾

---

**146) (اِلَّا الَّذِينَ تَابُوا وَاَصْلَحُوا) – nifaqlarından tövbə edib ondan sonra əvvəlki hallarını islah edib, nifaq halətlərini dəyişdirməyən münafiqlərdən ötrü nicat yoxdur, (وَاعْتَصَمُوا بِاللّٰهِ وَاَخْلَصُوا دِينَهُمْ لِلّٰهِ) – əhd və etimadları Allah-Təalaya olub, itaət və ibadətlərində və bütün əməllərində, dinlərində Allah-Təaladan ötrü ixlaslı olub, Allah-Təalaya şərik qoşmayanlar, (فَاُولٰٓئِكَ مَعَ الْمُؤْمِنِينَ) – nifaqdan tövbə edib qeyd olunan xüsusiyyətlərdə olanlar dünya və axirətdə möminlərlə bərabər olacaqdır. Möminlərə yetişən xeyir və mənfəət onlara da yetişəcəkdir. (وَسَوْفَ يُؤْتِ اللّٰهُ الْمُؤْمِنِينَ اَجْرًا عَظِيمًا) – əlbəttə, Allah-Təala möminlərə dünya və axirətdə böyük əcr və savab verəcəkdir. Habelə nifaqdan tövbə edənlər üçün də möminlərin əcr, savabı qədər xeyir olacaqdır.**

**147) (مَا يَفْعَلُ اللّٰهُ بِعَذَابِكُمْ) – siz münafiqlərə əzab etməkdə Allah-Təalanın istəyi nədir? ( Məqsədi mənfəət, yoxsa zərər verməkdir? Yoxsa qəzəb anında sizdən intiqam almaqdır? Bunların heç biri deyil, əksinə, ilahi hikmətə və siyasət qanununa görə gərək asi olan şəxslərə əzab olunsun). (اِنْ شَكَرْتُمْ وَاٰمَنْتُمْۜ وَكَانَ اللّٰهُ شَاكِرًا عَلِيمًا) – əgər siz * münafiqlər Allah-Təalaya şükür edib,**

*(****Qeyd:** *İslam şəriətində zahirdə iman izharı edib amma batində kafir olan şəxsə münafiq deyilir, bir də müsəlman görünüb, islamı ehkamlarını vəsf edib tərifləyən, amma islamın heç bir hökmünə əməl etməyən şəxsə münafiq deyilir, necə ki bizim bu zəmanəmizdə bəzi müsəlmanlar islamı, Quranı bu şəkildə tərifləyirlər, amma ehkamına əməl etmirlər. Quran boş yerə tərifləməkdən ötrü deyil, əməl etmək üçündür. Necə ki Hz. Əli (ə.s) buyurur: "Quranı özünüzə imam və rəhbər seçin". Bunun mənası odur ki, Quranı dillə tərifləmək kifayət etməz, əsl məqsəd onun bütün ehkamlarına əməl etməkdir. İslamda görünən bu zəiflik, günbəgün geriyə getmək, hamısı Quranın hökmünə əməl etməməkdən qaynaqlanır, hansı millət öz dininin qanunlarına əməl etməsə, o millət yox olub gedər, insaflı şəxslər diqqət etsinlər).*

**iman gətirsəniz, o vaxt əzaba layiq olmaqdan xilas olarsınız, Allah-Təala şükür edənlərə mükafat verər, sizin şükür və imanınızdan agahdır.**

**148) (لَا يُحِبُّ اللّٰهُ الْجَهْرَ بِالسُّوٓءِ مِنَ الْقَوْلِ اِلَّا مَنْ ظُلِمَ) – Allah-Təala siz insanların pis sözlər** (yalan, söyüş, qeybət və s.) **deməsini istəməz, ancaq zülmə məruz qalan istisnadır, məzlum şəxs zalım şəxsin barəsində əgər pis söz desə, ona rəvadır, yoxsa onun məzlum olması məlum olmaz, məzlumun pis sözlər deməsi Allah-Təala yanında qəbih deyildir. (وَكَانَ اللّٰهُ سَمِيعًا عَلِيمًا) –**

اِنْ تُبْدُوا خَيْرًا اَوْ تُخْفُوهُ اَوْ تَعْفُوا عَنْ سُوٓءٍ فَاِنَّ اللّٰهَ كَانَ عَفُوًّا قَدِيرًا ﴿١٤٩﴾ اِنَّ الَّذِينَ يَكْفُرُونَ بِاللّٰهِ
وَرُسُلِهِ وَيُرِيدُونَ اَنْ يُفَرِّقُوا بَيْنَ اللّٰهِ وَرُسُلِهِ وَيَقُولُونَ نُؤْمِنُ بِبَعْضٍ وَنَكْفُرُ بِبَعْضٍ وَيُرِيدُونَ اَنْ يَتَّخِذُوا بَيْنَ
ذٰلِكَ سَبِيلًا ﴿١٥٠﴾ اُو۬لٰٓئِكَ هُمُ الْكَافِرُونَ حَقًّا وَاَعْتَدْنَا لِلْكَافِرِينَ عَذَابًا مُهِينًا ﴿١٥١﴾ وَالَّذِينَ اٰمَنُوا
بِاللّٰهِ وَرُسُلِهِ وَلَمْ يُفَرِّقُوا بَيْنَ اَحَدٍ مِنْهُمْ اُو۬لٰٓئِكَ سَوْفَ يُؤْتِيهِمْ اُجُورَهُمْ وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا ﴿١٥٢﴾

---

**Allah-Təala məzlumun duasını eşidib, onun qəlbindən agahdır.** (Məzlum da gərək, Allah-Təaladan qorxub haqq söz desin).

**149) (اِنْ تُبْدُوا خَيْرًا اَوْ تُخْفُوهُ اَوْ تَعْفُوا عَنْ سُوٓءٍ) – əgər açıq-aşkar bir xeyir əməl etsəniz, ya da onu gizlin etsəniz, ya da əgər bir şəxs sizə pislik və zülm etsə, onu bağışlayıb keçsəniz,** (bunlar, xüsusən, bağışlamaq yaxşı, Allah-Təalanın xoşladığı əməldir). **(فَاِنَّ اللّٰهَ كَانَ عَفُوًّا قَدِيرًا) – həqiqətən, Allah-Təala günahkarları əfv edib bağışlayandır, həm də onlardan intiqam almağa qadirdir. Əgər siz də zülm edən şəxsin günahından keçib bağışlasanız, Allah-Təala yanında sizin üçün yaxşıdır.**

**150) (اِنَّ الَّذِينَ يَكْفُرُونَ بِاللّٰهِ وَرُسُلِهِ) – həqiqətən, Allah-Təalanı və onun peyğəmbərlərini inkar edənlər, (وَيُرِيدُونَ اَنْ يُفَرِّقُوا بَيْنَ اللّٰهِ وَرُسُلِهِ) – və Allah-Təalaya iman gətirməklə peyğəmbərlərə iman gətirməyin arasında fərq qoymaq istəyənlər** (yəni belə deyənlər: "Allah-Təalaya iman gətirmək kifayət edər, peyğəmbərlərə iman gətirmək lazım deyil", necə ki bizim bu dövrdə bu sözü və belə başqa küfr sözləri demək müsəlmanlar arasında rəvac tapıbdır), **(وَيَقُولُونَ نُؤْمِنُ بِبَعْضٍ وَنَكْفُرُ بِبَعْضٍ) – belə deyirlər: bəzi peyğəmbərlərə iman gətirib, bəzisini inkar edərik.** (Necə ki yəhudilər Musaya iman gətirib İsanı və Hz. Məhəmmədi inkar etdilər). **(وَيُرِيدُونَ اَنْ يَتَّخِذُوا بَيْنَ ذٰلِكَ سَبِيلًا) – onlar bu sözləriylə istəyirlər ki, özlərindən ötrü küfrlə iman arasında bir yol** (din) **seçsinlər. Bu sözləri deyənlər xəta edibdir, çünki küfrlə iman arasında orta yol olmaz, bütün peyğəmbərlərə iman gətirmək lazımdır, bəzisinə iman gətirib bəzisini inkar etmək tamamilə küfr və zəlalətdir, necə ki buyurur).**

**151) (اُو۬لٰٓئِكَ هُمُ الْكَافِرُونَ حَقًّا) – peyğəmbərlərin bəzisinə iman gətirib, bəzisinə iman gətirməyənlər həqiqi kafirlərdir. (وَاَعْتَدْنَا لِلْكَافِرِينَ عَذَابًا مُهِينًا) – kafirlərdən ötrü qiyamət günündə onları zəlil və həqir edən əzab hazır etmişik.**

**152) (وَالَّذِينَ اٰمَنُوا بِاللّٰهِ وَرُسُلِهِ وَلَمْ يُفَرِّقُوا بَيْنَ اَحَدٍ مِنْهُمْ) – o şəxslər ki Allah-Təalaya və onun peyğəmbərlərinə iman gətirib, peyğəmbərlərin heç birinin arasında fərq qoymurlar, (اُو۬لٰٓئِكَ سَوْفَ يُؤْتِيهِمْ اُجُورَهُمْ) – əlbəttə, Allah-Təala axirətdə onlara gözəl şəkildə əcrlərini verər. (وَكَانَ اللّٰهُ غَفُورًا رَحِيمًا) – Allah-Təala tövbə edənləri bağışlayıb rəhm edəndir.** (Yəhudilərdən Kə`b ibn Əşrəf və Fənhas ibn Azur və başqa yəhudilər Hz. Peyğəmbərin hüzuruna gəlib dedilər: "Ey

يَسْـَٔلُكَ اَهْلُ الْكِتَابِ اَنْ تُنَزِّلَ عَلَيْهِمْ كِتَابًا مِنَ السَّمَآءِ فَقَدْ سَاَلُوا مُوسٰىٓ اَكْبَرَ مِنْ ذٰلِكَ فَقَالُوٓا اَرِنَا
اللّٰهَ جَهْرَةً فَاَخَذَتْهُمُ الصَّاعِقَةُ بِظُلْمِهِمْ ۚ ثُمَّ اتَّخَذُوا الْعِجْلَ مِنْ بَعْدِ مَا جَآءَتْهُمُ الْبَيِّنَاتُ فَعَفَوْنَا عَنْ
ذٰلِكَ ۚ وَاٰتَيْنَا مُوسٰى سُلْطَانًا مُبِينًا ﴿١٥٣﴾ وَرَفَعْنَا فَوْقَهُمُ الطُّورَ بِمِيثَاقِهِمْ وَقُلْنَا لَهُمُ ادْخُلُوا الْبَابَ
سُجَّدًا وَقُلْنَا لَهُمْ لَا تَعْدُوا فِي السَّبْتِ وَاَخَذْنَا مِنْهُمْ مِيثَاقًا غَلِيظًا ﴿١٥٤﴾

---

peyğəmbər, əgər sən doğru peyğəmbərsənsə, səmadan bizə bir kitab gətir. Bu şərtlə ki, o kitabı gətirəndə biz özümüz də görək, sənə nazil olan bu Qurana biz iman gətirmərik”. O vaxt bu ayə nazil oldu).

**153) (يَسْـَٔلُكَ اَهْلُ الْكِتَابِ اَنْ تُنَزِّلَ عَلَيْهِمْ كِتَابًا مِنَ السَّمَآءِ)** – (ey Məhəmməd)**, əhli-kitab** (yəhudilər) **səndən səmadan onlara bir kitab nazil etməni istəyir, onların bu istəklərindən dilxor olma, (فَقَدْ سَاَلُوا مُوسٰىٓ اَكْبَرَ مِنْ ذٰلِكَ) – onların ata-babaları bundan da böyük şeyi Musadan istəmişdilər, (فَقَالُوٓا اَرِنَا اللّٰهَ جَهْرَةً) – dedilər: “Ey Musa, bizə Allah-Təalanı açıq-aşkar göstər, ondan sonra bilək ki, sən haqq olan peyğəmbərsən. (فَاَخَذَتْهُمُ الصَّاعِقَةُ بِظُلْمِهِمْ) – onların zülmlərinə** (bu sözlərinə) **görə səmadan bir od gəlib onları yandırdı. (Allah-Təalanın görünməsi imkansız olduğundan Allah-Təala onlara zalım deyib ildırımla onları həlak etdi). (ثُمَّ اتَّخَذُوا الْعِجْلَ مِنْ بَعْدِ مَا جَآءَتْهُمُ الْبَيِّنَاتُ) – bundan sonra Allah-Təala tərəfindən Musanın doğruluğuna açıq-aşkar möcüzələr gələndən sonra buzovu özlərinə tanrı və məbud etdilər. (فَعَفَوْنَا عَنْ ذٰلِكَ) – bu günahlarından tövbə etdilər, biz də onların tövbələrini qəbul edib günahlarını bağışladıq. (وَاٰتَيْنَا مُوسٰى سُلْطَانًا مُبِينًا) – Musaya onların üstündə açıq-aşkar hakimiyyət verdik.** (Hz. Musa tövbə etmələri üçün yəhudilərin bir-birilərini qətlə yetirməsini şərt qoşdu. Bu məsələ Bəqərə surəsində qeyd olunmuşdu)**.**

**154) (وَرَفَعْنَا فَوْقَهُمُ الطُّورَ بِمِيثَاقِهِمْ) – bəni-İsrail Tövratı qəbul etmədiyi üçün dağı qaldırıb, onların başının üstündə saxladıq ki, əhdlərində sabit olub Tövrata əməl etsinlər.** (Dağın qaldırılma əhvalatı Bəqərə surəsinin 63-cü ayəsində keçdi. Oraya baxılsın). **(وَقُلْنَا لَهُمُ ادْخُلُوا الْبَابَ سُجَّدًا) – bəni-İsrailə əmr etdik ki, toplanma** (ibadət) **çadırının qapısından səcdə edərək daxil olun. Bu əmrə itaət etməyib səcdəsiz daxil oldular. (وَقُلْنَا لَهُمْ لَا تَعْدُوا فِي السَّبْتِ) – yenə bəni-İsrailə əmr etdik ki, şənbə gününün ehtiramını saxlayın, o şeylər ki, sizə şənbə günündə haram olubdur, onlarla məşğul olmayın. (ov, alış-veriş etməyin), bəni-İsrail bu əmrə də itaət etməyib şənbə gününün ehtiramını pozdular. (وَاَخَذْنَا مِنْهُمْ مِيثَاقًا غَلِيظًا) – bəni-İsraildən möhkəm əhd almışdıq ki, Tövrata əməl etsinlər. Əhdi pozub Tövrata əməl etmədilər, o səbəbdən onlara əzab nazil edildi,** (Necə ki sıradakı ayədə buyurur)**.**

فَبِمَا نَقْضِهِمْ مِيثَاقَهُمْ وَكُفْرِهِمْ بِاٰيَاتِ اللّٰهِ وَقَتْلِهِمُ الْاَنْبِيَاۤءَ بِغَيْرِ حَقٍّ وَقَوْلِهِمْ قُلُوبُنَا غُلْفٌۜ بَلْ طَبَعَ اللّٰهُ
عَلَيْهَا بِكُفْرِهِمْ فَلَا يُؤْمِنُونَ اِلَّا قَلِيلًاۖ ﴿١٥٥﴾ وَبِكُفْرِهِمْ وَقَوْلِهِمْ عَلٰى مَرْيَمَ بُهْتَانًا عَظِيمًاۙ ﴿١٥٦﴾
وَقَوْلِهِمْ اِنَّا قَتَلْنَا الْمَسِيحَ عِيسَى ابْنَ مَرْيَمَ رَسُولَ اللّٰهِۚ وَمَا قَتَلُوهُ وَمَا صَلَبُوهُ وَلٰكِنْ شُبِّهَ لَهُمْۜ

---

**155) (فَبِمَا نَقْضِهِمْ مِيثَاقَهُمْ وَكُفْرِهِمْ بِاٰيَاتِ اللّٰهِ وَقَتْلِهِمُ الْاَنْبِيَاۤءَ بِغَيْرِ حَقٍّ وَقَوْلِهِمْ قُلُوبُنَا غُلْفٌ) – bəni-İsrail əhdlərini pozub, Tövrata əməl etməyib, Allah-Təalanın** (Musaya) **verdiyi möcüzələri inkar edib, peyğəmbərləri nahaq yerə qətlə yetirib, peyğəmbər onları dəvət etdikdə deyirdilər: "Bizim qəlbimizdə pərdə vardır, sizin sözlərinizi dərk edə bilmərik". Bu səbəblərə görə, onlara əzab nazil olundu. (بَلْ طَبَعَ اللّٰهُ عَلَيْهَا بِكُفْرِهِمْ) – bəni-İsrailin bu sözləri - bizim qəlbimizdə pərdə vardır, sizin sözlərinizi dərk edə bilmərik sözü batildir, əksinə, öz küfrlərinin səbəbinə Allah-Təala onların qəlblərinə elə bir möhür vurubdur ki, heç bir şey dərk edə bilməzlər. (فَلَا يُؤْمِنُونَ اِلَّا قَلِيلًاۖ) – yəhudilərin az bir qismi istisna olmaqla iman gətirməzlər.**

**156) (وَبِكُفْرِهِمْ وَقَوْلِهِمْ عَلٰى مَرْيَمَ بُهْتَانًا عَظِيمًاۙ) – bir də yəhudilər kafir olub Məryəmə böyük böhtan** (zina) **isnad etdikləri üçün Allah-Təala onlara əzab edəcəkdir.**

**157) (وَقَوْلِهِمْ اِنَّا قَتَلْنَا الْمَسِيحَ عِيسَى ابْنَ مَرْيَمَ رَسُولَ اللّٰهِ) – yenə Allah-Təala yəhudilərə - Allah-Təalanın peyğəmbəri olan İsa Məryəm oğlunu biz qətlə yetirdik, sözünə görə əzab edəcəkdir.** (Bu kəlam, yəni Allah-Təalanın peyğəmbəri sözü yəhudilərin sözü deyil. Hz. İsaya hörmət əlaməti olaraq yəhudilərin kəlamının arasındakı Allah-Təala sözüdür). (وَمَا قَتَلُوهُ وَمَا صَلَبُوهُ وَلٰكِنْ شُبِّهَ لَهُمْ) **– yəhudilərin biz İsanı qətlə yetirdik, deməsi yalan sözdür. İsanı* qətlə yetirmədilər və çarmıxa da çəkmədilər. Əksinə, o şəxs ki, İsaya oxşayırdı, onu qətlə yetirdilər.**

*(*Qeyd:* **Qeyd:** *Hz. İsanın İncildə qeyd olunan əhvalatı Qurana ziddir. 4 İncildə belə qeyd olunubdur: "İsanı çarmıxa çəkdilər, orada vəfat etdi, aparıb dəfn etdilər. 3 gündən sonra Allah-Təala onu qəbirdən qaldırıb səmalara apardı" (Matta, Bab: 27, cümlə: 44-46; Luka, Bab:23, cümlə:39-42). İncildə belə qeyd olunubdur, amma bu İncil səmavi İncil deyil, İsadan sonra onu yazıblar. Necə ki özünün məzmunu bu məsələyə şahiddir. O səbəbdən İncildə qeyd olunan əhvalat doğru deyil. Quranda qeyd olunan əhvalat - Allah-Təalanın İsanı vəfat etdirib, ruhlar aləminə aparması dəqiqdir: O həzrətin əhvalatı qısaca belədir ki, qeyd olunur. Yəhudilər Hz. İsadan bir çox möcüzə görsələr də, qəbul etməyib, özünə də zinadan əmələ gəlib, dedilər (Allah onlara lənət etsin)***.** *Yəhudilər dedilər ki, gərək İsanı qətlə yetirək, çünki küfr sözlər danışır. Hz. İsa 12 nəfər həvarisinə dedi: sizdən bir nəfər mənə xəyanət edib məni az bir qiymətə satacaqdır, hamısı inkar etdilər, şagirdlərindən biri – Yəhuda İskaryot xain olub gedib yəhudilərə dedi: "İsanı öldürməniz üçün sizə versəm, nə verərsiniz mənə?" Ona 30 parça gümüş verdilər. Gecə vaxtı Hz. İsa dağda ibadətlə məşğul olanda onları*

وَاِنَّ الَّذٖينَ اخْتَلَفُوا فٖيهِ لَفٖي شَكٍّ مِنْهُۜ مَا لَهُمْ بِهٖ مِنْ عِلْمٍ اِلَّا اتِّبَاعَ الظَّنِّۚ وَمَا قَتَلُوهُ يَقٖينًاۙ ﴿١٥٧﴾
بَلْ رَفَعَهُ اللّٰهُ اِلَيْهِۜ وَكَانَ اللّٰهُ عَزٖيزًا حَكٖيمًا ﴿١٥٨﴾ وَاِنْ مِنْ اَهْلِ الْكِتَابِ اِلَّا لَيُؤْمِنَنَّ بِهٖ قَبْلَ مَوْتِهٖۚ
وَيَوْمَ الْقِيٰمَةِ يَكُونُ عَلَيْهِمْ شَهٖيدًاۚ ﴿١٥٩﴾ فَبِظُلْمٍ مِنَ الَّذٖينَ هَادُوا حَرَّمْنَا عَلَيْهِمْ طَيِّبَاتٍ اُحِلَّتْ لَهُمْ

---

*götürüb gəldi. Dedi: “Siz durub baxın, mən kimə əl verib, üzündən öpsəm, o İsadır, onu tutun”. Yəhuda gəlib o həzrətə əl verib görüşdü, o biri tərəfdən yəhudilər gəlib, onu tutub qollarını bağlayıb apardılar. Libaslarını çıxarıb ona qırmızı libas geydirdilər. Tikandan tac kimi bir şey düzəldib onun başına qoydular, əlinə bir qamış verib dedilər: “Salam olsun sənə, ey bəni-İsrail padşahı,” ondan sonra qamışı əlindən alıb başına vurdular. (Bəli, həmişə Allah-Təalanın mömin bəndələri dünyada zəlil və həqir olublar). Ondan sonra qırmızı libası əynindən çıxarıb, onu apardılar ki, çarmıxa çəksinlər, Allah-Təala Hz. İsanı vəfat etdirib, ruhlar aləminə apardı. Ondan sonra yəhudilər Hz. İsanın haqqında ixtilaf etdilər. Bəzisi dedi: “Çarmıxa çəkilən odur,” bəzisi dedi: “O deyil, əgər çarmıxa çəkilən İsadırsa, bəs Yəhuda hanı, əgər bu Yəhudadırsa, bəs İsa necə oldu?” Necə ki Allah-Təala buyurur).*

**(وَاِنَّ الَّذٖينَ اخْتَلَفُوا فٖيهِ لَفٖي شَكٍّ مِنْهُ) – həqiqətən, İsa haqqında ixtilaf edən yəhudilər onu qətli haqqında da şəkk içində oldular.** (Bəzisi dedi: “Qətlə yetirilən İsadır,” bəzisi dedi: “O deyil”). **(مَا لَهُمْ بِهٖ مِنْ عِلْمٍ اِلَّا اتِّبَاعَ الظَّنِّ) – yəhudilərin İsanın ölümü haqqında məlumatı olmayıb, ancaq zənnə tabe olub dedilər: “Biz onu qətlə yetirdik”. (وَمَا قَتَلُوهُ يَقٖينًاۙ) –Hz. İsanı qətiyyən qətlə yetirmədilər.**

**158) (بَلْ رَفَعَهُ اللّٰهُ اِلَيْهِۜ) – əksinə, Allah-Təala Hz. İsanı vəfat etdirib, ucaldıb öz tərəfinə apardı. (وَكَانَ اللّٰهُ عَزٖيزًا حَكٖيمًا) – Allah-Təala bütün məxluqatına qalib olub öz hikməti üzrə İsanı yəhudilərdən xilas etdi.** (Hz. İsanı aparmaqdan məqsəd ruhunu aparmaqdır, çünki bədənin ruhlar aləminə daxil olması imkansızdır. Necə ki Ali-İmran surəsinin 41-ci ayəsinin təfsirində qeyd olundu. Oraya baxılsın, habelə bundan sonra gələn Maidə surəsinin sonundan da bu mətləb məlum olur. Bu ayədən məlum olan budur ki, yəhudilər onu qətlə yetirməyiblər).

**159) (وَاِنْ مِنْ اَهْلِ الْكِتَابِ اِلَّا لَيُؤْمِنَنَّ بِهٖ قَبْلَ مَوْتِهٖۚ) – əhli-kitab Allah-Təala haqqında ixtilaf edib bir qismi Üzeyri, digər qismi də Hz. İsanı ona şərik qoşandan sonra elə bir yəhudi və xristian olmaz ki, ölmədən əvvəl Allah-Təalaya iman gətirib onun vəhdaniyyətini iqrar etməsin. (وَيَوْمَ الْقِيٰمَةِ يَكُونُ عَلَيْهِمْ شَهٖيدًاۚ) – qiyamət günündə Allah-Təala özü əhli-kitabın əməllərinə şahidlik edib, onlara əzab edər.**

**160) (فَبِظُلْمٍ مِنَ الَّذٖينَ هَادُوا حَرَّمْنَا عَلَيْهِمْ طَيِّبَاتٍ اُحِلَّتْ لَهُمْ) –etdikləri zülm səbəbi ilə yəhudilərə halal olan pak ruziləri onlara haram etdik. (Halal olan ruzilərdən quşu, dırnaq sahibi öküz və qoyun piyini, dəvənin ətini və südünü Allah-Təala onlara haram etdi. Halal ruzinin onlara haram olma**

وَبِصَدِّهِمْ عَنْ سَبِيلِ اللّٰهِ كَث۪يرًاۙ ﴿١٦٠﴾ وَاَخْذِهِمُ الرِّبٰوا وَقَدْ نُهُوا عَنْهُ وَاَكْلِهِمْ اَمْوَالَ النَّاسِ بِالْبَاطِلِۜ
وَاَعْتَدْنَا لِلْكَافِر۪ينَ مِنْهُمْ عَذَابًا اَل۪يمًا﴿١٦١﴾ لٰكِنِ الرَّاسِخُونَ فِي الْعِلْمِ مِنْهُمْ وَالْمُؤْمِنُونَ يُؤْمِنُونَ
بِمَٓا اُنْزِلَ اِلَيْكَ وَمَٓا اُنْزِلَ مِنْ قَبْلِكَ وَالْمُق۪يم۪ينَ الصَّلٰوةَ وَالْمُؤْتُونَ الزَّكٰوةَ وَالْمُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ
الْاٰخِرِۜ اُو۬لٰٓئِكَ سَنُؤْت۪يهِمْ اَجْرًا عَظ۪يمًا ﴿١٦٢﴾ اِنَّٓا اَوْحَيْنَٓا اِلَيْكَ كَمَٓا اَوْحَيْنَٓا اِلٰى نُوحٍ وَالنَّبِيّ۪نَ مِنْ
بَعْدِه۪ۚ وَاَوْحَيْنَٓا اِلٰٓى اِبْرٰه۪يمَ وَاِسْمٰع۪يلَ وَاِسْحٰقَ وَيَعْقُوبَ وَالْاَسْبَاطِ وَع۪يسٰى وَاَيُّوبَ وَيُونُسَ وَهٰرُونَ
وَسُلَيْمٰنَۚ وَاٰتَيْنَا دَاوُ۫دَ زَبُورًاۚ ﴿١٦٣﴾

---

**səbəbi isə etdikləri zülm - buzova sitayiş etmək, Allah-Təalanı görmək istəmək, Tövratın ehkamını qəbul etməmək və s. zülmlərdir ki, keçən ayələrdə zikr olunubdur. Belə şeylərə görə, Allah-Təala pak şeyləri onlara haram etdi). (**وَبِصَدِّهِمْ عَنْ سَبِيلِ اللّٰهِ كَث۪يرًاۙ**) – bir də halal olan şeyləri onlara haram etdik, ona görə ki, çox insanın Allah-Təala yoluna daxil olub iman gətirməsinə mane olurdular.**

**161) (**وَاَخْذِهِمُ الرِّبٰوا وَقَدْ نُهُوا عَنْهُ**) – bir də faiz aldıqlarına görə** (haram etdik)**, çünki faiz almaları qadağan edilmişdi. (**وَاَكْلِهِمْ اَمْوَالَ النَّاسِ بِالْبَاطِلِۜ**) – bir də xalqın malını batil və nahaq yolla** (rüşvət almaq kimi) **yediklərinə görə** (haram etdik), **(**وَاَعْتَدْنَا لِلْكَافِر۪ينَ مِنْهُمْ عَذَابًا اَل۪يمًا**) – kafir olan yəhudilərdən ötrü qiyamət günündə şiddətli əzabı hazır etdik.** (sələmçi, rüşvətxor müsəlmanlar bu ayəyə baxsınlar).

**162) (**لٰكِنِ الرَّاسِخُونَ فِي الْعِلْمِ مِنْهُمْ وَالْمُؤْمِنُونَ**) – yəhudilər küfr və inadlarında sabitdirlər, lakin** (ey Məhəmməd)**, yəhudilərdən elmdə sabit və möhkəm olub bəsirət sahibi olan şəxslər, (**يُؤْمِنُونَ بِمَٓا اُنْزِلَ اِلَيْكَ وَمَٓا اُنْزِلَ مِنْ قَبْلِكَ**) – sənə nazil olan Qurana və səndən qabaq nazil olan kitablara iman gətirirlər. (**وَالْمُق۪يم۪ينَ الصَّلٰوةَ وَالْمُؤْتُونَ الزَّكٰوةَ**) – namaz qılıb zəkat verirlər. (**وَالْمُؤْمِنُونَ بِاللّٰهِ وَالْيَوْمِ الْاٰخِرِ**) – Allah-Təalaya və axirət gününə iman gətirməkdə sabit və möhkəm olurlar. (**اُو۬لٰٓئِكَ سَنُؤْت۪يهِمْ اَجْرًا عَظ۪يمًا**) – əlbəttə, belə şəxslərə axirətdə böyük əcr və savab bəxş edərik.**

**163) (**اِنَّٓا اَوْحَيْنَٓا اِلَيْكَ كَمَٓا اَوْحَيْنَٓا اِلٰى نُوحٍ وَالنَّبِيّ۪نَ مِنْ بَعْدِه۪ۚ**) –** (ey Məhəmməd)**, sənə vəhy edib ehkam göndərdik, necə ki səndən qabaq Nuha və ondan sonra İbrahimin zamanına kimi gələn peyğəmbərlərə vəhy edib ehkam göndərdik. (**وَاَوْحَيْنَٓا اِلٰٓى اِبْرٰه۪يمَ وَاِسْمٰع۪يلَ وَاِسْحٰقَ وَيَعْقُوبَ وَالْاَسْبَاطِ وَع۪يسٰى وَاَيُّوبَ وَيُونُسَ وَهٰرُونَ وَسُلَيْمٰنَۚ وَاٰتَيْنَا دَاوُ۫دَ زَبُورًا**) –** (ey Məhəmməd)**, yenə sənə vəhy göndərdiyimiz kimi bu qeyd olunan peyğəmbərlərə də vəhy göndərdik. Davud peyğəmbərə Zəburu bəxş etdik.** (Yəhudilər bunların hamısını bilirlər, necə ki bu peyğəmbərlərə ehkam göndərib kitab vermişik, habelə sənə də ehkam göndərib kitab vermişik, bəs niyə səndən başqa kitab istəyirlər? Əgər istədikləri kimi sənə başqa bir kitab göndərsək də, yenə iman gətirməzlər.

وَرُسُلًا قَدْ قَصَصْنَاهُمْ عَلَيْكَ مِنْ قَبْلُ وَرُسُلًا لَمْ نَقْصُصْهُمْ عَلَيْكَ ۜ وَكَلَّمَ اللّٰهُ مُوسٰى تَكْلِيمًاۚ
﴿١٦٤﴾ رُسُلًا مُبَشِّرِينَ وَمُنْذِرِينَ لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللّٰهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِۜ وَكَانَ اللّٰهُ عَزِيزًا
حَكِيمًا﴿١٦٥﴾ لٰكِنِ اللّٰهُ يَشْهَدُ بِمَآ اَنْزَلَ اِلَيْكَ اَنْزَلَهُ بِعِلْمِهٖۚ وَالْمَلٰٓئِكَةُ يَشْهَدُونَ ۜ وَكَفٰى بِاللّٰهِ شَهِيدًا
﴿١٦٦﴾ اِنَّ الَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ قَدْ ضَلُّوا ضَلَالًا بَعِيدًا﴿١٦٧﴾

---

**164) (وَرُسُلًا قَدْ قَصَصْنَاهُمْ عَلَيْكَ مِنْ قَبْلُ)** – (ey Məhəmməd)**, bəzi peyğəmbərlərin əhvalatını bundan qabaq sənə nəql etmişik. (وَرُسُلًا لَمْ نَقْصُصْهُمْ عَلَيْكَ ۜ وَكَلَّمَ اللّٰهُ مُوسٰى تَكْلِيمًاۚ) – Allah-Təala peyğəmbərlərin içindən Musa ilə bir növ sözlə** (vasitəsiz) **danışdı.**

**165) (رُسُلًا مُبَشِّرِينَ وَمُنْذِرِينَ) – Allah-Təala peyğəmbərləri öz rəhmətilə müjdələyən və əzabı ilə qorxudan göndəribdir. (لِئَلَّا يَكُونَ لِلنَّاسِ عَلَى اللّٰهِ حُجَّةٌ بَعْدَ الرُّسُلِ) – peyğəmbərləri göndərdi ki, insanların peyğəmbərlərdən sonra Allah-Təalaya qarşı bir dəlili və bəhanəsi olub deməsinlər ki, bizə* niyə peyğəmbər göndərməmiş əzab edirsən? (وَكَانَ اللّٰهُ عَزِيزًا حَكِيمًا) – Allah-Təala asilərə əzab etməkdə qalibdir. Peyğəmbərlər göndərib insanların arasında ehkam qoymaqda hikmət sahibidir.**

*(****Qeyd:*** *Allah-Təala tərəfindən peyğəmbər gəlməsə də, ağıl onu tanımağa kafidir, amma peyğəmbər iki şeydən ötrüdür. Birincisi - insanları qəflət yuxusundan oyadıb ilahi elmlərlə agah etmək, ikincisi - məxluqat arasında şəriət qanununu - necə ki bəzi peyğəmbərlər vəz edib, ya da şəriətlə birlikdə siyasət qanununu yaymaq üçün - necə ki bizim uca peyğəmbərimiz Hz. Məhəmməd vəz edib, lazımdır).*

**166) (لٰكِنِ اللّٰهُ يَشْهَدُ بِمَآ اَنْزَلَ اِلَيْكَ)** – (ey Məhəmməd)**, yəhudilər və müşriklər Allah-Təalanın sənə kitab nazil etməsinə şahidlik etməzlər. Lakin Allah-Təala özü şahidlik edər ki, Quranı öz tərəfindən sənə nazil edibdir. Bu Quran Allah-Təaladan haqq və səhih olan kitabdır. (اَنْزَلَهُ بِعِلْمِهٖۚ) – Quranı özünə xas olan elmiylə sənə nazil etdi ki, səndən ötrü möcüzə olsun, heç bir nəfər onun müqabilində söz deyə bilməsin. (وَالْمَلٰٓئِكَةُ يَشْهَدُونَ) – mələklər** (ağıl və ruh gücü) **şahidlik edirlər ki, bu Quran Allah-Təala tərəfindən haqq və doğru olan kitabdır. (وَكَفٰى بِاللّٰهِ شَهِيدًا) – hərçənd mələklər də şahidlik edərlər, amma təkcə Allah-Təalanın şahidliyi kifayət edər. Ondan başqa şahidlik edən lazım deyildir.**

**167) (اِنَّ الَّذِينَ كَفَرُوا وَصَدُّوا عَنْ سَبِيلِ اللّٰهِ) – həqiqətən, o şəxslər** (yəhudilər) **ki, kafir olub özlərindən başqa şəxslərin də islama daxil olmasına mane olur, (قَدْ ضَلُّوا ضَلَالًا بَعِيدًا) – həqiqətən, hidayət yolundan son dərəcə uzaq düşüb azıblar.**

اِنَّ الَّذٖينَ كَفَرُوا وَظَلَمُوا لَمْ يَكُنِ اللّٰهُ لِيَغْفِرَ لَهُمْ وَلَا لِيَهْدِيَهُمْ طَرٖيقًاۙ ﴿١٦٨﴾ اِلَّا طَرٖيقَ جَهَنَّمَ
خَالِدٖينَ فٖيهَٓا اَبَدًاۜ وَكَانَ ذٰلِكَ عَلَى اللّٰهِ يَسٖيرًا ﴿١٦٩﴾ يَٓا اَيُّهَا النَّاسُ قَدْ جَٓاءَكُمُ الرَّسُولُ بِالْحَقِّ مِنْ
رَبِّكُمْ فَاٰمِنُوا خَيْرًا لَكُمْۜ وَاِنْ تَكْفُرُوا فَاِنَّ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ وَكَانَ اللّٰهُ عَلٖيمًا حَكٖيمًا
﴿١٧٠﴾ يَٓا اَهْلَ الْكِتَابِ لَا تَغْلُوا فٖي دٖينِكُمْ وَلَا تَقُولُوا عَلَى اللّٰهِ اِلَّا الْحَقَّۜ اِنَّمَا الْمَسٖيحُ عٖيسَى ابْنُ
مَرْيَمَ رَسُولُ اللّٰهِ وَكَلِمَتُهُۚ اَلْقٰيهَٓا اِلٰى مَرْيَمَ وَرُوحٌ مِنْهُۘ فَاٰمِنُوا بِاللّٰهِ وَرُسُلِهٖۚ وَلَا تَقُولُوا ثَلٰثَةٌۜ اِنْتَهُوا
خَيْرًا لَكُمْۜ

---

**168-169) (**اِنَّ الَّذٖينَ كَفَرُوا وَظَلَمُوا**) – həqiqətən, kafir və zalım olan şəxsləri, (**لَمْ يَكُنِ اللّٰهُ لِيَغْفِرَ لَهُمْ**) – Allah-Təala bağışlayan deyil. (**وَلَا لِيَهْدِيَهُمْ طَرٖيقًاۙ اِلَّا طَرٖيقَ جَهَنَّمَ خَالِدٖينَ فٖيهَٓا اَبَدًا**) – və içində əbədi qalacaqları cəhənnəm yolundan başqa heç bir xeyir yoluna onları hidayət edən deyildir. (**وَكَانَ ذٰلِكَ عَلَى اللّٰهِ يَسٖيرًا**) – onlara əzab edib, həmişəlik cəhənnəmdə saxlamaq Allah-Təalaya asan olan bir əməldir.**

**170) (**يَٓا اَيُّهَا النَّاسُ قَدْ جَٓاءَكُمُ الرَّسُولُ بِالْحَقِّ مِنْ رَبِّكُمْ**)** – (bu ayə bütün insanlığa xitabdır), **buyurur: “Ey insanlar, həqiqətən,** (bu Məhəmməd)**, sizin rəbbiniz Allah-Təala tərəfindən sizə haqq olan islamla peyğəmbər gəlibdir. (**فَاٰمِنُوا خَيْرًا لَكُمْ**) – ona iman gətirib xeyir olan bir işi** (imana daxil olmağı) **edin. (**وَاِنْ تَكْفُرُوا فَاِنَّ لِلّٰهِ مَا فِي السَّمٰوَاتِ وَالْاَرْضِ**) – əgər Hz. Məhəmmədi və islamı inkar etsəniz, Allah-Təala sizə möhtac deyildir. Həqiqətən, səmalarda və yerdə olan məxluqatın hakimiyyəti Allah-Təalaya məxsusdur. (**وَكَانَ اللّٰهُ عَلٖيمًا حَكٖيمًا**) – Allah-Təala etdiyiniz əməllərdən agahdır və hikmət üzrə sizə əmr edəndir.**

**171) (**يَٓا اَهْلَ الْكِتَابِ لَا تَغْلُوا فٖي دٖينِكُمْ**)** – (yəhudilər Hz. İsanın haqqında batil etiqad edib dedilər: “Ola bilməz ki, İsa atasız dünyaya gəlsin,” amma bəzi xristianlar dedilər: “İsa Allahdır,” bəziləri də dedilər: “Allahın oğludur,” Allah-Təala bu ayədə hər iki qrupa xitab edib buyurur:) **Ey yəhudilər və xristianlar, dininizdə həddinizi aşan söz danışmayın.** (Hz. İsadan ötrü ona layiq olmayan sözləri deməyin). **(**وَلَا تَقُولُوا عَلَى اللّٰهِ اِلَّا الْحَقَّ**) – Allah-Təalaya haqq olan sözdən başqasını isnad etməyin.** (siz yəhudilər – Hz. İsa atasız ola bilməz, deməyin, siz xristianlar - İsa Allahdır, ya da Allahın oğludur, deməyin). **(**اِنَّمَا الْمَسٖيحُ عٖيسَى ابْنُ مَرْيَمَ رَسُولُ اللّٰهِ وَكَلِمَتُهُۚ اَلْقٰيهَٓا اِلٰى مَرْيَمَ وَرُوحٌ مِنْهُ**) – həqiqətən, İsa Məryəm oğlu Allah-Təalanın peyğəmbəri və Allah-Təalanın bir kəlməsiylə vücuda gələndir. O kəlməsini Məryəmə tərəf yönləndirib Məryəm İsaya hamilə oldu və o, Allah-Təaladan bir ruhdur** (atasız dünyaya gəlibdir). **(**فَاٰمِنُوا بِاللّٰهِ وَرُسُلِهٖ**) – Allah-Təalaya və onun peyğəmbərlərinə iman gətirin, onlardan biri də İsadır. (**وَلَا تَقُولُوا ثَلٰثَةٌۜ اِنْتَهُوا خَيْرًا لَكُمْ**) – deməyin ki, 3 Allah (Allah-Təala, İsa, Ruhülqüds) vardır, bu sözü tərk edin. Ondan yaxşı söz** (Allah bir-

اِنَّمَا اللّٰهُ اِلٰهٌ وَاحِدٌ سُبْحَانَهُ اَنْ يَكُونَ لَهُ وَلَدٌ لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَكَفٰى بِاللّٰهِ وَكِيلًا
﴿١٧١﴾ لَنْ يَسْتَنْكِفَ الْمَسِيحُ اَنْ يَكُونَ عَبْدًا لِلّٰهِ وَلَا الْمَلٰئِكَةُ الْمُقَرَّبُونَ وَمَنْ يَسْتَنْكِفْ عَنْ عِبَادَتِهِ
وَيَسْتَكْبِرْ فَسَيَحْشُرُهُمْ اِلَيْهِ جَمِيعًا ﴿١٧٢﴾ فَاَمَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فَيُوَفِّيهِمْ اُجُورَهُمْ
وَيَزِيدُهُمْ مِنْ فَضْلِهِ وَاَمَّا الَّذِينَ اسْتَنْكَفُوا وَاسْتَكْبَرُوا فَيُعَذِّبُهُمْ عَذَابًا اَلِيمًا وَلَا يَجِدُونَ لَهُمْ مِنْ
دُونِ اللّٰهِ وَلِيًّا وَلَا نَصِيرًا ﴿١٧٣﴾ يَا اَيُّهَا النَّاسُ قَدْ جَآءَكُمْ بُرْهَانٌ مِنْ رَبِّكُمْ

---

dir) **deməyə çalışın.** (اِنَّمَا اللّٰهُ اِلٰهٌ وَاحِدٌ) – **həqiqətən, haqq olan məbud pak və müqəddəs bir zatdır.** (سُبْحَانَهُ اَنْ يَكُونَ لَهُ وَلَدٌ) – **Allah-Təala övladı olmaqdan pak və münəzzəhdir.** (Övladın olması üçün cismə, bədənə sahib olmaq lazımdır. Allah-Təala bundan pak və münəzzəhdir). (لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ) – **səmalarda və yerdə olan hər bir şey Allah-Təalaya məxsusdur, Allah-Təalanın övlada ehtiyacı yoxdur.** (وَكَفٰى بِاللّٰهِ وَكِيلًا) – **Allah-Təala bütün məxluqatın işlərinə vəkil olub onların işlərini təkcə idarə etməkdə kifayət edər.**

**172)** (لَنْ يَسْتَنْكِفَ الْمَسِيحُ اَنْ يَكُونَ عَبْدًا لِلّٰهِ) – **Hz. İsa, əlbəttə, Allah-Təalaya qul olmaqdan özünü kənar etməz və bunu özünə ar bilməz,** (وَلَا الْمَلٰئِكَةُ الْمُقَرَّبُونَ) – **mərtəbələri Allah-Təalaya yaxın və İsadan artıq olan mələklər** (müqəddəs və ruhani qüvvələr) **də yenə Allah-Təalaya qul olmağı özlərinə ar bilməzlər,** (وَمَنْ يَسْتَنْكِفْ عَنْ عِبَادَتِهِ وَيَسْتَكْبِرْ) – **kim özünü Allah-Təalanın ibadətindən kənar edib təkəbbürlənib, qürurlansa,** (فَسَيَحْشُرُهُمْ اِلَيْهِ جَمِيعًا) – **əlbəttə, Allah-Təala onların hamısını qiyamət günündə öz tərəfinə toplayıb, onlara əzab edəcəkdir.**

**173)** (فَاَمَّا الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) – **amma o şəxslər ki iman gətirib yaxşı əməllər edərlər,** (فَيُوَفِّيهِمْ اُجُورَهُمْ وَيَزِيدُهُمْ مِنْ فَضْلِهِ) – **Allah-Təala o əməllərin cəza və savabını onlara yetirib o əməllərinin əcrindən başqa öz lütf və rəhmətindən onların savabını artırar.** ( وَاَمَّا الَّذِينَ اسْتَنْكَفُوا وَاسْتَكْبَرُوا) – **amma o şəxslər ki Allah-Təalaya ibadət etməkdən kənar olub təkəbbürlənib, qürurlanırlar,** (فَيُعَذِّبُهُمْ عَذَابًا اَلِيمًا) – **Allah-Təala onlara şiddətli əzab edəcəkdir.** (وَلَا يَجِدُونَ لَهُمْ مِنْ دُونِ اللّٰهِ وَلِيًّا وَلَا نَصِيرًا) – **əzab olunan şəxslər Allah-Təaladan başqa nə özlərinə sahib çıxan bir şəxs, nə də onları əzabdan xilas edən bir köməkçi tapa bilməzlər.**

**174)** (يَا اَيُّهَا النَّاسُ قَدْ جَآءَكُمْ بُرْهَانٌ مِنْ رَبِّكُمْ) – **ey insanlar, həqiqətən,** (bu Məhəmməd) **sizə rəbbiniz Allah-Təaladan islamın haqq olmasında bir dəlil və sübut gəlibdir. Bu* Məhəmmədin varlığı sizdən ötrü aşkar olan bir dəlildir. Başqa dəlil lazım deyil. Bununla belə, sizə Quran kimi kitab göndərmişəm.**

وَاَنْزَلْنَٓا اِلَيْكُمْ نُورًا مُبِينًا ﴿١٧٤﴾ فَاَمَّا الَّذٖينَ اٰمَنُوا بِاللّٰهِ وَاعْتَصَمُوا بِهٖ فَسَيُدْخِلُهُمْ فٖي رَحْمَةٍ مِنْهُ
وَفَضْلٍۙ وَيَهْدٖيهِمْ اِلَيْهِ صِرَاطًا مُسْتَقٖيمًاۜ ﴿١٧٥﴾ يَسْتَفْتُونَكَۜ قُلِ اللّٰهُ يُفْتٖيكُمْ فِي الْكَلَالَةِۜ اِنِ
امْرُؤٌا هَلَكَ لَيْسَ لَهُ وَلَدٌ وَلَهُ اُخْتٌ فَلَهَا نِصْفُ مَا تَرَكَۚ وَهُوَ يَرِثُهَٓا اِنْ لَمْ يَكُنْ لَهَا وَلَدٌۜ فَاِنْ
كَانَتَا اثْنَتَيْنِ فَلَهُمَا الثُّلُثَانِ مِمَّا تَرَكَۜ وَاِنْ كَانُٓوا اِخْوَةً رِجَالًا وَنِسَٓاءً

---

*(*Qeyd: Kim insafla ərəb millətinin adət və əxlaqına, onların vəhşi əməllərinə fikir versə, o vaxt ondan ötrü Hz. Peyğəmbərin haqq olması aydın olar. Zahir və batiniylə elm, mədəniyyət və kamilliklə süslənən Hz. Məhəmmədin kəsilən heyvanın qanını içən, dəvənin yununu bişirib yeyən ərəblərin içindən çıxıb bütün insanlıq aləminə parlaq bir nur kimi işıq saçması o mübarək şəxsin haqq olmasına möhkəm bir dəlil və qəti bir sübut deyilmi?)*

(وَاَنْزَلْنَٓا اِلَيْكُمْ نُورًا مُبِينًا) – **açıq-aşkar olan nuru** (Qurani-Şərifi) **sizə nazil etdik.** (Necə ki nur səbəbinə insan yer üzündə hər bir yolu tapıb gedər, habelə Quranın nuruyla həqiqət yolunu axtaran da haqqa qovuşar).

**175)** (فَاَمَّا الَّذٖينَ اٰمَنُوا بِاللّٰهِ وَاعْتَصَمُوا بِهٖ) – **amma o şəxslər ki Allah-Təalaya iman gətirib ona möhkəm yapışıb, imanlarında sabit və möhkəm olar,** (فَسَيُدْخِلُهُمْ فٖي رَحْمَةٍ مِنْهُ وَفَضْلٍ) – **əlbəttə, Allah-Təala onları öz əməllərinin səbəbinə öz lütf və rəhmətinə daxil edər.** (وَيَهْدٖيهِمْ اِلَيْهِ صِرَاطًا مُسْتَقٖيمًا) – **Allah-Təala onları öz tərəfinə düz olan yola hidayət edər.** (Hz. Peyğəmbər axırıncı – Vida həcci deyilən hzccdə Məkkə yolunda ikən Cabir ibn Abdullah Ənsari gəlib soruşdu: “Ey Peyğəmbər, əgər bacım ölsə, onun malından mənə nə qədər miras çatar? O vaxt bu ayə nazil oldu, ayədə qardaş bacıdan nə qədər miras alar hökmü təfsilatı ilə bəyan edilir. Bu ayə ayrıca nazil olduğundan surənin əvvəlində qeyd olunan miras ayələrindən ayrı düşüb surənin axırında öz məqamında qeyd olundu. Hz. Peyğəmbər Quranın tərtibində ayələrin nazil olma sırasını nəzərə alıb, ayələrin bu tərtiblə qeyd edilməsini vəhy katiblərinə əmr edərdi. Bu ayə Hz. Peyğəmbərə nazil olan axırıncı ayədir. Budur ayə:)

**176)** (يَسْتَفْتُونَكَۜ قُلِ اللّٰهُ يُفْتٖيكُمْ فِي الْكَلَالَةِ) – (ey Məhəmməd)**, bacı-qardaşın bir-birindən miras alması xüsusunda səndən fitva istəyirlər. Onlara de ki, Allah-Təala ata və anadan olan bacı-qardaş haqqında sizə fitva verib buyurur:** (اِنِ امْرُؤٌا هَلَكَ) – **əgər bir kişi ölsə,** (لَيْسَ لَهُ وَلَدٌ) – **onun özündən sonra övladı qalmasa,** (وَلَهُ اُخْتٌ فَلَهَا نِصْفُ مَا تَرَكَ) – **və onun bir nəfər bacısı (ata-anadan, ya da təkcə atadan) özündən sonra qalsa, o bacısına onun malının yarısı çatar.** (وَهُوَ يَرِثُهَٓا اِنْ لَمْ يَكُنْ لَهَا وَلَدٌ) – **amma əgər bacısı ölüb, özündən sonra bir nəfər qardaşı (ata-anadan, ya da təkcə atadan) ona varis olsa, o qardaş onun bütün malına varis olar.** (فَاِنْ كَانَتَا اثْنَتَيْنِ فَلَهُمَا الثُّلُثَانِ مِمَّا تَرَكَ) – **əgər iki** (ya da çox) **bacısı qardaşa varis olsa, onlara qardaşın malından 3-də ikisi çatar.** (وَاِنْ كَانُٓوا اِخْوَةً رِجَالًا وَنِسَٓاءً) – **əgər qardaşa, ya da ba-**

فَلِلذَّكَرِ مِثْلُ حَظِّ الْاُنْثَيَيْنِ يُبَيِّنُ اللّٰهُ لَكُمْ اَنْ تَضِلُّوا وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿١٧٦﴾

---

**cıya varis olanlar həm kişi, həm də qadın olaraq bir neçə nəfər olsa, onun bütün malını bölərlər. (فَلِلذَّكَرِ مِثْلُ حَظِّ الْاُنْثَيَيْنِ) – kişiyə iki qadının hissəsi qədər çatar, (يُبَيِّنُ اللّٰهُ لَكُمْ اَنْ تَضِلُّوا) – Allah-Təala sizdən ötrü hər bir hökmü bəyan buyurur ki, zəlalətə vaqe olmayasınız. (وَاللّٰهُ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) – Allah-Təala hər bir şeydən agahdır.** (Ayə ata-anadan, ya da təkcə atadan olan bacı-qardaşın mirası haqqındadır. Amma təkcə anadan olan bacı-qardaşın miras hökmü surənin əvvəlindəki miras ayələrində qeyd olunmuşdur. Bacıların hissəsindən artıq qalan malın hökmü surənin əvvəlindəki miras ehkamında qeyd olunub. Oraya baxılsın).

Allaha həmd olsun, Nisa surəsinin təfsiri tamamlandı, Hz. Peyğəmbər buyurubdur: "Kim Nisa surəsini oxusa, o şəxs şirkdən kənar olub Allah-Təalanın bağışladığı şəxslərdən hesab olunar" (oxumaqda məqsəd əməl etməkdir).

## əl-MAİDƏ SURƏSİ

5-ci surədir. Mədinədə nazil olub, 120 ayə, 2854 kəlmə və 11733 hərfdir.

بِسْمِ اللهِ الرَّحْمٰنِ الرَّحِيمِ. يَا أَيُّهَا الَّذِينَ آمَنُوا أَوْفُوا بِالْعُقُودِ أُحِلَّتْ لَكُمْ بَهِيمَةُ الْأَنْعَامِ إِلَّا مَا يُتْلَى
عَلَيْكُمْ غَيْرَ مُحِلِّي الصَّيْدِ وَأَنْتُمْ حُرُمٌ إِنَّ اللَّهَ يَحْكُمُ مَا يُرِيدُ ﴿١﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تُحِلُّوا
شَعَائِرَ اللَّهِ

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا أَوْفُوا بِالْعُقُودِ) – ey iman gətirən şəxslər, Allah-Təalanın peyğəmbəri** (Hz. Məhəmmədin) **vasitəsilə sizinlə etdiyi əhdlərə vəfa edin (Onun ehkamına əməl edin, halalını halal, haramını haram bilib, heç vaxt Allah-Təalanın itaətindən çıxmayın. Ayədə Allah-Təala əvvəlcə əhdə vəfalı olmağı əmr edib, ondan sonra halal və haramı qeyd etməyə başlayır). * -(أُحِلَّتْ لَكُمْ بَهِيمَةُ الْأَنْعَامِ إِلَّا مَا يُتْلَى عَلَيْكُمْ) – dörd ayaqlı heyvanlardan dəvə, öküz, qoyun, keçi sizə halal edildi, ancaq haram olanlar bundan sonra sizdən ötrü qeyd olunacaqdır. (غَيْرَ مُحِلِّي الصَّيْدِ وَأَنْتُمْ حُرُمٌ) – Məkkədə ehramda olan zaman ovlayıb özünüzə halal etmək istisna olmaqla qeyd olunan dörd ayaqlı heyvanlar sizə halaldır, (Çöldə olan heyvanları ehramda olan vaxt ovlamaq haramdır. Amma dənizdəkiləri ovlamaq haram deyil). (إِنَّ اللَّهَ يَحْكُمُ مَا يُرِيدُ) – həqiqətən, Allah-Təala istədiyini – xalqın xeyrini düşünüb onun halal, ya da haram olmasına hökm edər.**

*(****Qeyd:*** *Ərəblər dörd ayaqlı heyvana - dəvə, öküz, qoyun, keçiyə bəhimə deyirlər).*

**2) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تُحِلُّوا شَعَائِرَ اللَّهِ) – ey iman gətirən şəxslər, Məkkədə Allah-Təalaya ibadət olunan yerlərin ehtiramını pozmayın və ibadət edənlərin orada ibadət etmələrinə mane olmayın. O ibadət yerlərində lazım olan əməlləri tərk etməyin.** (Məkkədəki ibadət yerləri Kəbə, Məscidül-haram, məqami-İbrahim, Səfa ilə Mərvənin arası, Məkkənin ətrafındakı Mina, Ərəfat və məş`ərül-haramdır. Amma bu yerlərdə lazım olan əməllər: (Məkkədə) tavaf, tavaf namazı, Səfa ilə Mərvə arasında “sə`y” edib 7 dəfə gedib-gəlmək, “təqsir” – saçı qısaltmaq, ehrama girməkdir. Məkkənin ətrafında olan məqamlarda əməllər – Ərəfatda “vəqfə” edib durmaq, məş`ərül-haramda “vəqfə” edib durmaq, Minada “rəmy”, “cəmrə” (şeytan daşlama), qurban kəsmək, baş qırxdırmaq kimi əməllərə və bu əməllərin ediləcəyi yerlərə - ha-

وَلَا الشَّهْرَ الْحَرَامَ وَلَا الْهَدْيَ وَلَا الْقَلَائِدَ وَلَا آمِّينَ الْبَيْتَ الْحَرَامَ يَبْتَغُونَ فَضْلًا مِنْ رَبِّهِمْ وَرِضْوَانًا وَإِذَا حَلَلْتُمْ فَاصْطَادُوا وَلَا يَجْرِمَنَّكُمْ شَنَآنُ قَوْمٍ أَنْ صَدُّوكُمْ عَنِ الْمَسْجِدِ الْحَرَامِ أَنْ تَعْتَدُوا وَتَعَاوَنُوا عَلَى الْبِرِّ وَالتَّقْوَى وَلَا تَعَاوَنُوا عَلَى الْإِثْمِ وَالْعُدْوَانِ وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ ﴿٢﴾ حُرِّمَتْ عَلَيْكُمُ الْمَيْتَةُ وَالدَّمُ وَلَحْمُ الْخِنْزِيرِ وَمَا أُهِلَّ لِغَيْرِ اللَّهِ بِهِ

---

mısına hörmət etmək lazımdır və bu əməllərin təfsilatı Bəqərə surəsinin 196-cı ayəsinin təfsirində keçdi. Oraya baxılsın). **(وَلَا الشَّهْرَ الْحَرَامَ) – həcc ayları** (şəvval, zülqədə, zülhiccə) **bu haram ayların ehtiramını pozmayın. (və ləl-hədyə* və ləl-qəlaid)** (وَلَا الْهَدْيَ وَلَا الْقَلَائِدَ) **– Kəbənin qurbanlarının Kəbəyə aparılmasına mane olub onlara hörmətsizlik etməyin.**

*(*Qeyd: “hədy” - Kəbəyə aparılan dəvə, öküz, qoyun kimi qurbanlardır. “Qəlaid” - o qurbanlardan ibarətdir ki, onların boyunlarına boyunbağı, ya da bir parça ip bağlayardılar ki, onların qurbanlıq olması məlum olsun).*

**Xüsusən, o qurbanlıqlara ki, onların bir əlaməti və nişanı olsun. (وَلَا آمِّينَ الْبَيْتَ الْحَرَامَ) – Kəbə ziyarətinə niyyət edib Məkkəyə gedən şəxslərə mane olmayın. (يَبْتَغُونَ فَضْلًا مِنْ رَبِّهِمْ وَرِضْوَانًا) – o şəxslər ki Məkkəyə gedib Allah-Təalanın savabını və məmnunluğunu istəyirlər, onların Məkkəyə getmələrinə mane olmaq olmaz. (وَإِذَا حَلَلْتُمْ فَاصْطَادُوا) – o zaman ki ehramdan çıxdınız, o vaxt ov etmək sizə halaldır.** (وَلَا يَجْرِمَنَّكُمْ شَنَآنُ قَوْمٍ أَنْ صَدُّوكُمْ عَنِ الْمَسْجِدِ الْحَرَامِ أَنْ تَعْتَدُوا) – (ey Məhəmməd)**, sizin Məkkəyə daxil olmanıza mane olan bir qövmün ədavəti,** (Məkkəli Qüreyş əhli Hüdeybiyyə ilində peyğəmbərin və onun səhabələrinin Məkkəyə daxil olmalarına mane olmuşdular) **sizi onlardan intiqam almağa vadar etməsin. (وَتَعَاوَنُوا عَلَى الْبِرِّ وَالتَّقْوَى) – yaxşı əməldə və* bağışlamaqda və təqvada** (Allah qorxusu) **bir-birinizə kömək edin. (وَلَا تَعَاوَنُوا عَلَى الْإِثْمِ وَالْعُدْوَانِ) – günahda, düşmənçilikdə və intiqam almaqda yardımlaşmayın. (وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ) – Allah-Təaladan qorxub qeyd olunan hökmlərdən vaz keçməyin, həqiqətən, Allah-Təala şiddətli əzab edəndir.**

*(*Qeyd: Nə gözəl dindir islam, düşməni əfv edib bağışlamaq islamın əsas hökmlərindəndir).*

**3) (حُرِّمَتْ عَلَيْكُمُ الْمَيْتَةُ وَالدَّمُ وَلَحْمُ الْخِنْزِيرِ) – haram olan şeylər bunlardır ki, qeyd olunur, buyurur: haram olubdur sizə** (kəsilmədən ölən) **o heyvanın ölüsü** (hansı ki onun əti sizə halal idi. Bir də heyvanın başı kəsilən vaxt ondan axan) **qan, bir də donuzun əti. (وَمَا أُهِلَّ لِغَيْرِ اللَّهِ بِهِ) – və bir də kəsilən vaxt Allah-Təaladan başqasının adı zikr olunan heyvan sizə haram olub.** (Yəni o heyvan kəsiləndə Allah-Təaladan başqasının adı gərək zikr olunmasın, necə ki müşriklər heyvanı qurban edəndə belə deyərdilər: “Bu heyvanı əl-Lat, əl-

وَالْمُنْخَنِقَةُ وَالْمَوْقُوذَةُ وَالْمُتَرَدِّيَةُ وَالنَّطِيحَةُ وَمَا أَكَلَ السَّبُعُ إِلَّا مَا ذَكَّيْتُمْ وَمَا ذُبِحَ عَلَى النُّصُبِ وَأَنْ تَسْتَقْسِمُوا بِالْأَزْلَامِ

---

Uzza adına qurban kəsirik”). (وَالْمُنْخَنِقَةُ) – **haram olan heyvanlardan biri də boğulub ölən heyvandır.** (وَالْمَوْقُوذَةُ) – **bir də o heyvandır ki, uca bir yerdən yıxılıb, ya da quyuya düşüb ölüb.** (وَالْمُتَرَدِّيَةُ وَالنَّطِيحَةُ) – **bir də o heyvandır ki, başqa bir heyvan buynuzu ilə onu vurub öldürüb.** (وَمَا أَكَلَ السَّبُعُ إِلَّا مَا ذَكَّيْتُمْ) – **bir də o heyvandır ki, onu yırtıcı heyvan yeyib, bəzi orqanları qalıb, - ancaq onu diri ikən şəriətə müvafiq kəssəniz, bu, istisnadır, (heyvan kəsiləndən sonra əl-ayaq çalıb adət üzrə ondan qan getsə, belə halda o heyvan sizə halaldır).** (وَمَا ذُبِحَ عَلَى النُّصُبِ) – (Məkkədə Kəbənin ətrafında böyük daşlar ucaltmışdılar, bütlərdən başqa onlara da ibadət edirdilər. Götürüb onların qabağında qurban kəsib o qurbanın ətini parça-parça edib o daşların üstünə tökərdilər ki, camaat aparsın, bunu Allah-Təalaya yaxınlaşmaq üçün vasitə hesab edərdilər. Allah-Təala o heyvanın ətini haram edib buyurur:) **daşlara təzim etməkdən ötrü kəsilən heyvanın əti sizə haram* olubdur.**

*(****Qeyd:*** *Bu heyvanlarla bizim dövrümüzdə filan daş, filan ocaq, ya da filan ağanın qapısı, ya da filan məqamda kəsilən heyvan arasında heç bir fərq yoxdur. Çünki onu kəsməkdə məqsəd ətini yemək olub, gərək Allah-Təalanın adı zikr olunaraq kəsilsin. O heyvanın kəsilməsində bundan başqa bir niyyət olsa, o heyvanın əti haramdır, Məkkədə o daşlara kəsilən qurban kimidir. Ərəb əyanları bir-birilərinə qarşı öyünməkdən ötrü heyvan kəsib, öz qövmlərinə paylayardılar. Ərəb əyanlarından Süheym Riyahi, bir də Qalib (şair Fərəzdağın atası) bir-birilərinə qarşı öyünüb dəvə kəsdilər. 10 dəvədən başlayıb hər biri 200 dəvəyədək kəsdilər. Ondan sonra Süheym bir dəfədə 300 dəvə kəsdi. Qalib aciz qalıb dayandı. Süheym Qalibə qalib oldu. Bu əhvalat Hz. Əlinin xilafəti zamanında Kufənin ətrafında vaqe oldu. Kufə əhli dəvələrin kəsilməsindən xəbərdar olub dəvələrin kəsildiyi yerdən ət götürmək üçün ora yönəldilər. Hz. Əli bu mətləbdən xəbərdar olub hökm verdi ki, o ətlərdən yeməsinlər, o heyvanlar öyünmək üçün kəsildiyindən onların əti haramdır. Dərmanı olmayan cəhalət xəstəliyi islam ümməti arasında o qədər yayılıb ki, nəfsani arzularına tabe olan rəhbərlər öz mənfəətlərinə görə, xalqı cəhalətə salıb nəzir adıyla halal heyvanı kəsməyi əmr edib, ətini haram edirlər. Allah-Təala özü onlardan intiqam alsın).*

(وَأَنْ تَسْتَقْسِمُوا بِالْأَزْلَامِ) – (Məkkədə Qüreyş camaatı ağacdan 3 parça oxu özlərindən ötrü fal açmaq üçün ayırmışdılar. O ağaclara “əzlam”, “qədəh” (qumar oxları) deyərdilər, o ağacların birində “rəbbim əmr etdi mənə“, o birisində “rəbbim qadağan etdi mənə” yazılmışdı. Üçüncüsündə yazı yox idi. Bir işə başlamaq istəyəndə, böyük bütləri Hübəlin yanına gələrdilər, qumar oxlarının yanında olan şəxsə 100 dirhəm verərdilər. O şəxs onlardan ötrü fal açardı. Hər şəxsin istəyinə müvafiq o ağaclardan nə çıxsaydı, ona görə əməl edərdilər. Allah-Təala bu fal açmağı haram buyurur. Ayənin mənası belədir:) **fal oxları**

ذَلِكُمْ فِسْقٌ الْيَوْمَ يَئِسَ الَّذِينَ كَفَرُوا مِنْ دِينِكُمْ فَلَا تَخْشَوْهُمْ وَاخْشَوْنِ الْيَوْمَ أَكْمَلْتُ لَكُمْ دِينَكُمْ وَأَتْمَمْتُ عَلَيْكُمْ نِعْمَتِي وَرَضِيتُ لَكُمُ الْإِسْلَامَ دِينًا فَمَنِ اضْطُرَّ فِي مَخْمَصَةٍ غَيْرَ مُتَجَانِفٍ لِإِثْمٍ فَإِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ ﴿٣﴾

---

**ilə öz barənizdə Allah-Təalanın qismətini və hökmünü bilmək sizə haram olundu.** (Onlar deyirdilər ki, fal oxundan çıxan hökm bizim aramızda Allah-Təalanın hökmü və qismətidir. Allah-Təala isə onların sözünü batil edir ki, heç vaxt fal oxu ilə Allah-Təalanın hökmünü bilmək olmaz). **(ذَلِكُمْ فِسْقٌ) – bu qeyd olunan haram şeylərə əməl etmək günahdır, onlardan çəkinin. (الْيَوْمَ يَئِسَ الَّذِينَ كَفَرُوا مِنْ دِينِكُمْ) – bu gün** (bu şeylər sizə haram olub)**, kafir şəxslər də sizin dininizdən ümidlərini kəsdilər. Daha onların dininə qayıtmayıb onların halal saydığı şeyləri siz halal saymayacaqsınız. Onların halal şeylərini siz haram biləndə gərək onlardan birdəfəlik çəkinəsiniz.** (İslamda haram elan edilən bu şeylərin hamısını müşriklər halal sayırdılar). **(فَلَا تَخْشَوْهُمْ وَاخْشَوْنِ) – müşriklərdən qorxmayın, məndən qorxun ki, mənim əmrimin ziddini etməyəsiniz, müşriklər mənim qüdrət əlimdən qurtula bilməzlər. (الْيَوْمَ أَكْمَلْتُ لَكُمْ دِينَكُمْ) – bu gün (yəni bu dövrdə siz Mədinədəki müsəlmanlar müşriklərə qalib olub, hər bir işiniz tərəqqi tapıb, müşriklər sizdən ümidlərini kəsdilər) dininizi sizdən ötrü tamamladım, onda heç bir nöqsan qoymadım. (وَأَتْمَمْتُ عَلَيْكُمْ نِعْمَتِي) – və öz nemətimi sizə tamam edib, hər bir halal və haramı sizə hikmət üzrə bəyan etdim. (وَرَضِيتُ لَكُمُ الْإِسْلَامَ دِينًا) – sizin üçün dinlər arasından islamdan razı olub onu seçdim. İslamı möhkəm tutun, ondan kənar olmayın, mənim seçilmiş dinim islamdır. (فَمَنِ اضْطُرَّ فِي مَخْمَصَةٍ غَيْرَ مُتَجَانِفٍ لِإِثْمٍ) – kim bu qeyd olunan haram şeylərdən qəhətlik və aclıq məqamında naəlac qalıb yesə, o vaxt yemək halaldır. Amma o miqdarda ki, aclığını yox edib, haram yeməkdə günaha meyli olmasın və həddindən çox yeməsin. (فَإِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ) – həqiqətən, Allah-Təala belə məqamda bağışlayıb rəhm edəndir.** (Bu surənin hamısı Mədinədə nazil olubdur, ancaq bu qeyd olunan ayə Məkkədə Vida həccində nazil oldu).

*(*Qeyd:* *Biz müsəlmanlar arasında nə qədər belə batil əməllər vardır. Nə Allah-Təalanın sözündən ibrət alırıq, nə uca peyğəmbərimizin əmrlərinə əməl edirik, nə də insaniyyət xüsusiyyətlərinə sahib olub insanlıq aləminə daxil oluruq. Lənət olsun o şəxslərə ki, xalqı aldadıb, aldadıcı sözləriylə onların mallarını tovlayıb alırlar. Bu falnamə filan imamdandır, bu fal (cifr) kitabı Hz. Əlidən nəql olunubdur, deyib mədə xəstəliyinə düçar olan şəxslərdən ötrü üçbucaq, dördbucaq formalarında rəqəmlər yazıb, çoxlu pul alıb xəstəliyin sağalması üçün ümid verirlər. Xalq da cəhalət dərdinə düçar olduqlarından aldanaraq o sözləri vəhy kimi qəbul edib, onlara etiqad edirlər. Belə bir üstün əxlaqı əmr edən ilahi kəlam bizim aramızda mövcud ola-ola, bu cəhalət xəstəliyinə necə düçar olduq, çox təəccüblüdür).*

يَسْأَلُونَكَ مَاذَا أُحِلَّ لَهُمْ قُلْ أُحِلَّ لَكُمُ الطَّيِّبَاتُ وَمَا عَلَّمْتُمْ مِنَ الْجَوَارِحِ مُكَلِّبِينَ تُعَلِّمُونَهُنَّ مِمَّا عَلَّمَكُمُ اللَّهُ فَكُلُوا مِمَّا أَمْسَكْنَ عَلَيْكُمْ وَاذْكُرُوا اسْمَ اللَّهِ عَلَيْهِ وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ سَرِيعُ الْحِسَابِ ﴿٤﴾ الْيَوْمَ أُحِلَّ لَكُمُ الطَّيِّبَاتُ

---

**4) (يَسْأَلُونَكَ مَاذَا أُحِلَّ لَهُمْ)** – (ey Məhəmməd)**, səndən soruşurlar ki, bu şeylər haram olandan sonra, bəs onlardan ötrü nə halal edilibdir? (قُلْ أُحِلَّ لَكُمُ الطَّيِّبَاتُ)** – (ey Məhəmməd)**, onlara de ki, hər bir pak və təmiz olan şeylər sizə halal edilibdir.** (İnsan təbiətinin yeməkdən çəkinmədiyi, haram olması haqda Quran və hədislərdə bir dəlilin olmadığı hər bir şey pak və halaldır və insan təbiətinin yeməkdən çəkindiyi hər bir şey, məsələn, həşəratlar, çöldə olan heyvanların əksəriyyəti və s. şeylər pis və haramdır). **(وَمَا عَلَّمْتُمْ مِنَ الْجَوَارِحِ مُكَلِّبِينَ تُعَلِّمُونَهُنَّ مِمَّا عَلَّمَكُمُ اللَّهُ)** – **bir də təlim verdiyimiz vəhşi** (ov) **heyvanlarının ovu sizə halaldır,** (bir halda ki, Allah-Təalanın sizə verdiyi ağılla, öyrətdiyi ov elmindən o heyvanlara təlim keçəsiniz, belə vaxtda onların ovu sizə halaldır. Amma təlim edilməyən heyvanların ovu sizə halal deyildir. Elmin şərəfinə bu kifayət edər ki, Allah-Təala ən murdar heyvanın (itin) ovunu elm səbəbinə halal buyurubdur. Ovlayan heyvanlar iki növdür: bir qismi quşlardandır, tərlan, qızılquş, qırğı və bunlardan başqa ovçular tərəfindən bilinən digər ov quşları. İkinci növ yırtıcı heyvanlar - it, pələng, bəbir və bunlardan başqa yırtıcı heyvanlar da var ki, ovlamağa qabildirlər. Hərçənd bizim aramızda itdən başqa ov heyvanı bilinmir. Amma ərəblərin arasında itdən başqa heyvanla da ov etmək adəti var idi. Bu iki növ ov heyvanı ki, qeyd olundu, onların ovu halaldır, bu şərtlə ki, o heyvanlar təlim keçmiş olsunlar. Yəni ona elə təlim verilsin ki, sahibi ona getməyi əmr edəndə gedib, dayanmağı əmr edəndə dayansın. Öz istəyi ilə getməsin və ovu tutub sahibindən ötrü saxlasın. O ovu sahibindən izinsiz yeməsin. Onu sahibi ova göndərəndə Allah-Təalanın adını deyib ondan sonra göndərsin. Necə ki sıradakı ayədə qeyd olunacaqdır. Bu şərtlərlə hər bir ov heyvanının ovu halaldır, əgər bu şərtlərin biri olmasa, o ov halal deyildir). **(فَكُلُوا مِمَّا أَمْسَكْنَ عَلَيْكُمْ)** – **təlim keçən ov heyvanlarının sizdən ötrü tutub saxladığı ovdan yeyin, sizə halaldır.** (Bu kəlam ona işarədir ki, ov heyvanı gərək ovu tutub, sahibindən ötrü saxlayıb, ondan izinsiz yeməsin), **(وَاذْكُرُوا اسْمَ اللَّهِ عَلَيْهِ)** – **ova göndərəndə Allah-Təalanın adını zikr edin ki, o ov sizə halal olsun.** (Bu kəlam ona işarədir ki, gərək, heyvanı ova göndərəndə Allah-Təalanın adı, məsələn, bismillah deyilsin). **(وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ سَرِيعُ الْحِسَابِ)** – **Allah-Təaladan qorxub halal və haramı dəyişdirməyin. Həqiqətən, Allah-Təala qiyamət günündə sürətlə haqq-hesab çəkəndir.**

**5) (الْيَوْمَ أُحِلَّ لَكُمُ الطَّيِّبَاتُ)** – **bugünkü gündə ki, islam dini rövnəq tapıbdır, pak olan şeylər sizə halal edildi,** (bu hökmü yenidən qeyd etmək təkid üçündür ki, islam şəriətində haram olmayan şeyləri özünüzə haram etməyin).

**وَطَعَامُ الَّذِينَ أُوتُوا الْكِتَابَ حِلٌّ لَكُمْ وَطَعَامُكُمْ حِلٌّ لَهُمْ وَالْمُحْصَنَاتُ مِنَ الْمُؤْمِنَاتِ وَالْمُحْصَنَاتُ مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ إِذَا آتَيْتُمُوهُنَّ أُجُورَهُنَّ مُحْصِنِينَ غَيْرَ مُسَافِحِينَ وَلَا مُتَّخِذِي أَخْدَانٍ وَمَنْ يَكْفُرْ بِالْإِيمَانِ فَقَدْ حَبِطَ عَمَلُهُ وَهُوَ فِي الْآخِرَةِ مِنَ الْخَاسِرِينَ ﴿٥﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا قُمْتُمْ إِلَى الصَّلَاةِ فَاغْسِلُوا وُجُوهَكُمْ وَأَيْدِيَكُمْ إِلَى الْمَرَافِقِ**

---

**(وَطَعَامُ الَّذِينَ أُوتُوا الْكِتَابَ حِلٌّ لَكُمْ) – bir də əhli-kitabın yeməyi sizə haladır.** (Əhli kitab - yəhudi, xristian və atəşpərəstlərdir. Yeməkdən məqsəd bütün yeməli şeylərdir. Təfsirçilərin əksəriyyəti deyib ki, yeməkdən məqsəd əhli-kitabın kəsdikləridir. Bəzilərinə görə isə məqsəd kəsilən və ya kəsilməyən bütün yeməli şeylərdir). **(وَطَعَامُكُمْ حِلٌّ لَهُمْ) – sizin də yeməyiniz əhli-kitaba halaldır,** (məsələn, onları qonaq çağırıb yemək vermək halaldır, onlara da yemək verin). **(وَالْمُحْصَنَاتُ مِنَ الْمُؤْمِنَاتِ) – iffətli və saleh olan qadınlarla evlənmək sizə halaldır.** (Bu ayə saleh və iffətli qadınlarla evlənməyi təşviq edir)**. (وَالْمُحْصَنَاتُ مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ) – bir də sizdən əvvəl kitab verilən şəxslərdən (yəhudi, xristian və atəşpərəstlərdən) iffətli və ismətli qadınları almaq sizə halaldır.** (Bu ayə əhli-kitabla evlənməyə açıq-aşkar icazədir. Şiə alimləri onlarla daimi nikahla evlənməyi caiz görməyib, ayəni mütə nikahına isnad ediblər, necə ki əvvəlki ayədə yeməyi dənli yeməklərə isnad ediblər. Kaş mən buna agah olaydım ki, əhli-kitabın təmizliyinə inanmamaqla yanaşı, onlarla mutə nikahına necə fitva veriblər. Görəsən, evlənmə işində daimi və ya mutə nikahının bir fərqi vardırmı?)**. (إِذَا آتَيْتُمُوهُنَّ أُجُورَهُنَّ) – mehriyyələrini tamamilə verdiyiniz zaman qadınlarla nikahlanmaq sizə caizdir.** (Əgər bir şəxs qadının mehriyyəsini verməməyi düşünərək onunla evlənsə, o şəxs zinakar hökmündədir). **(مُحْصِنِينَ غَيْرَ مُسَافِحِينَ) – ismətli qadınlarla evlənin ki, siz də ismət sahibi olub, zinakar olmayasınız. (وَلَا مُتَّخِذِي أَخْدَانٍ) – və özünüz üçün zinakar qadınlardan gizlin aşna tutmayın.** (Necə ki bizim bu zamanımızda aşna saxlayıb, halal qadınları evlərində qoyub, zinakar qadınlarla günah iş görürlər. Ey müsəlmanlar, ayəyə baxıb Allah-Təalanın hökmünə itaət edin. Dünyanın 5 günlük ləzzətini əbədi əzabdan üstün tutmayın. Halal qadınlarınızın haqqını yeməyin. Özünüzü kafir hökmünə salmayın. Çünki Allah-Təalanın hökmündən çıxanlar kafir hökmündədir. Bundan sonra gələn ayəyə bax, gör nə buyurur). **(وَمَنْ يَكْفُرْ بِالْإِيمَانِ فَقَدْ حَبِطَ عَمَلُهُ) – kim slamın ehkamlarını inkar edib, zinakar qadınlardan özünə aşna tutub, Allah-Təalanın halal və haramına inanmasa, həqiqətən, onun xeyir əməli olsa da o, batildir. Ondan ona heç bir fayda olmaz. (وَهُوَ فِي الْآخِرَةِ مِنَ الْخَاسِرِينَ) – o şəxs axirət günündə zərər çəkən şəxslərdəndir.**

**6) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِذَا قُمْتُمْ إِلَى الصَّلَاةِ)** – (bu ayə dəstəmaz barəsindədir)**. Ey iman gətirən şəxslər, namaza durmaq istədiyinizdə, (فَاغْسِلُوا وُجُوهَكُمْ وَأَيْدِيَكُمْ إِلَى الْمَرَافِقِ) – üzünüzü yuyun, əllərinizi də dirsəyə kimi yuyun,** ("ilə" kəlməsi

وَامْسَحُوا بِرُءُوسِكُمْ وَأَرْجُلَكُمْ إِلَى الْكَعْبَيْنِ وَإِنْ كُنْتُمْ جُنُبًا فَاطَّهَّرُوا وَإِنْ كُنْتُمْ مَرْضَى أَوْ عَلَى سَفَرٍ

---

ərəb dilində sonuna qədər mənasındadır, ayədə də tam yumaq mənasındadır. "İlə" kəlməsi hüdudu təyin etməkdən ötrü dirsək kəlməsi ilə birlikdə işlənib. Amma yumağın xüsusiyyəti – dirsəyin başı, yoxsa barmaqların başından olsun, ayədə onun bəyanı yoxdur və lazım da deyil. Çünki yumaq adət-ənənəyə əsasəndir. Necə ki Allah-Təala üzdə və qüsldə yumağın keyfiyyətini bəyan etməyib, örfdə olan adətə əsaslanıb, habelə əllərin yuyulması da adət necədirsə, gərək, o cür yuyulsun. Ağıl sahibləri diqqət etsin). (**وَامْسَحُوا بِرُءُوسِكُمْ وَأَرْجُلَكُمْ إِلَى الْكَعْبَيْنِ**) - (Red: Bəzi alimlər başı məsh ayaqları yumaq, bəziləri isə həm başı, həm də ayaqları məsh etməyi əsas almışlar)**, buyurur: dəstəmazda başlarınızı məsh edin, ayaqlarınızı da oynağa kimi məsh edin.** (Ayədəki ayaq sözünü özündən qabaqkı baş kəlməsinə isnad ediblər. Zəməxşəri "Təfsiri-Kəşşaf"da bu isnadı düzəltmək barəsində bir söz qeyd edibdir, çox təəccüblüdür. İslamın əvvəlində şəriət sahibinin (Hz. Məhəmməd) əməli ayaqların yuyulması yönündə idi. H. 8-ci ildə bu ayə nazil olub müsəlmanlara çətin olmasın deyə ayaqları məsh etməyi sabit etdi. Necə ki ayaqları yumağı qəbul edən alimlərin bir qismi səfərdə çətin olmasın deyə ayaqqabı üstündən məsh etməyə fitva veriblər. İnsaf üzrə fikir verilsin. İbn Abbas deyibdir: "Dəstəmaz iki yumaq, iki məsh etməkdir, iki yumaq - bir üz, bir də əllər, iki məsh – bir baş, bir də ayaqlar". Təfsirçilərdən Qətadə də belə deyibdir. Ənəs ibn Malik deyibdir: "Quran ayaqları məshə əmr edib, peyğəmbərin sünnəsi isə əvvəlcə yumaq idi". İkrimə deyibdir: "Dəstəmazda ayaqları yumaq yoxdur. Ayaqların barəsində məsh nazil olubdur". Şa`bi deyibdir: "Ayaqlarda məshdir, məshdən başqa bir şey yoxdur". (Ayədə keçən "kə`beyn" sözünün mənasında üləma ixtilaf edib. Əksər üləma deyiblər: "kə`beyn" baldırdan aşağı ayağa doğru iki sümükdür. Bir qisim də belə deyib: "Kə`b - iki ayağın üstündə olan qübbələrdir. Hər ayaqda bir qübbə var". Hilli və ondan başqa bəziləri deyiblər: "Ayaqla baldırın bir-birindən aralanan yerinə "kə`b" deyilir". Üləmanın sözü təəccüblüdür, çünki "kə`b" aşkar olan bir şeydir, insanda və bütün heyvanlarda mövcuddur, kə`b-türk dilində "aşıq", topuq, necə ki qoyunun aşığı hər bir şəxsə məlumdur, habelə insanda da aşıq (topuq) vardır. Əgər ərəbə aşığı göstərib desən, bu, nədir? Hər halda deyər: "həzə kə`bun" – bu, aşıqdır. Amma insandakı aşıq sümüyünü, gərək, anatomiya alimlərindən soruşaq. Onlar bəyan ediblər ki, insanın aşığı ayaqla baldırı arasındadır. Alimə müraciət etməyib, elmdə şəxsi rəylə danışmaqla ixtilaf çıxar. Buna görə də gərək ayağın topuq yerinədək məsh edilsin, doğrusunu Allah bilir). (**وَإِنْ كُنْتُمْ جُنُبًا فَاطَّهَّرُوا**) - **əgər cünüb olsanız, o vaxt qüsl eyləyin.** (İki məqamda "cənabət" (cünüblük) qüslü lazım olar: birincisi - yuxuda və ya oyaq vaxtı insandan sperma çıxanda, digəri də qadınla əlaqədə olanda, hətta sperma çıxmasa da, yenə qüsl lazımdır). (**وَإِنْ كُنْتُمْ مَرْضَى أَوْ عَلَى سَفَرٍ**) - **əgər xəstə olub, ya da**

أَوْ جَاءَ أَحَدٌ مِنْكُمْ مِنَ الْغَائِطِ أَوْ لاَمَسْتُمُ النِّسَاءَ فَلَمْ تَجِدُوا مَاءً فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا فَامْسَحُوا بِوُجُوهِكُمْ وَأَيْدِيكُمْ مِنْهُ مَا يُرِيدُ اللّٰهُ لِيَجْعَلَ عَلَيْكُمْ مِنْ حَرَجٍ وَلَكِنْ يُرِيدُ لِيُطَهِّرَكُمْ وَلِيُتِمَّ نِعْمَتَهُ عَلَيْكُمْ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٦﴾ وَاذْكُرُوا نِعْمَةَ اللّٰهِ عَلَيْكُمْ وَمِيثَاقَهُ الَّذِي وَاثَقَكُمْ بِهِ إِذْ قُلْتُمْ سَمِعْنَا وَأَطَعْنَا وَاتَّقُوا اللّٰهَ إِنَّ اللّٰهَ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٧﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا كُونُوا قَوَّامِينَ لِلّٰهِ شُهَدَاءَ بِالْقِسْطِ وَلَا يَجْرِمَنَّكُمْ شَنَآنُ قَوْمٍ عَلَى أَلَّا تَعْدِلُوا

---

**səfərdə olsanız,** (أَوْ جَاءَ أَحَدٌ مِنْكُمْ مِنَ الْغَائِطِ) – **ya da ayaqyolundan gəldikdə,** (أَوْ لاَمَسْتُمُ النِّسَاءَ) – **ya da qadınlarla yaxınlıq etdiyinizdə,** (فَلَمْ تَجِدُوا مَاءً) – **qeyd olunan bu kimi hallarda əgər dəstəmaz, ya da qüsldən ötrü su tapmasanız,** (فَتَيَمَّمُوا صَعِيدًا طَيِّبًا) – **o vaxt nəcisdən pak olan yerə təyəmmüm edin.** (فَامْسَحُوا بِوُجُوهِكُمْ وَأَيْدِيكُمْ مِنْهُ) – **elə ki "təyəmmüm" etdiniz, ondan üzünüzə, əllərinizə məsh edin,** (təyəmmümün xüsusiyyəti Nisa surəsinin 44-cü ayəsinin təfsirində bəyan olundu. Oraya baxılsın). (مَا يُرِيدُ اللّٰهُ لِيَجْعَلَ عَلَيْكُمْ مِنْ حَرَجٍ) – **Allah-Təala sizdən ötrü din işlərində çətin və müşkülü istəmədiyi üçün təyəmmümü əmr etdi. Ta ki müşkülə düşməyəsiniz.** (وَلَكِنْ يُرِيدُ لِيُطَهِّرَكُمْ) – **Allah-Təalanın istəyi odur ki, su olmayanda torpaqla sizi pak etsin,** (وَلِيُتِمَّ نِعْمَتَهُ عَلَيْكُمْ) – **və təyəmmümə icazə verməklə öz nemətini sizə tamam etsin. Belə ki, hər bir halda onun ibadətinə davam edəsiniz.** (لَعَلَّكُمْ تَشْكُرُونَ) – **əlbəttə, gərək Allah-Təalanın nemətlərinə şükür edəsiniz ki, sizə mükafat versin.**

**7)** (وَاذْكُرُوا نِعْمَةَ اللّٰهِ عَلَيْكُمْ) – (ey möminlər), **Allah-Təalanın sizə bəxş etdiyi nemətlərini yadınıza salın.** (وَمِيثَاقَهُ الَّذِي وَاثَقَكُمْ بِهِ) – **bir də Allah-Təalanın sizinlə bağladığı əhdi yadınıza salın.** (Allah-Təalanın bu əhdi Hz. Peyğəmbərin müsəlmanlardan aldığı əhddən ibarətdir. Müsəlmanlardan əhd aldı. Gərək hər bir vaxt itaətdə olsunlar. Onlar da itaət etdilər. Necə ki Allah-Təala buyurur:) (إِذْ قُلْتُمْ سَمِعْنَا وَأَطَعْنَا) – **o zaman ki Allah-Təala Hz. Məhəmmədin (ə.s) vasitəsilə sizdən əhd aldı, siz dediniz: "Eşitdik və itaət etdik". Bəs bu əhdinizdə və itaətinizdə sabit və möhkəm olun.** (وَاتَّقُوا اللّٰهَ) – **Allah-Təaladan qorxub, əhdi pozub, itaətdən çıxmayın.** (إِنَّ اللّٰهَ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ) – **həqiqətən, Allah-Təala sinələrdə olan sirlərdən agahdır. Bəs siz səmimi-qəlbdən itaətdəsiniz, yoxsa yox?**

**8)** (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا كُونُوا قَوَّامِينَ لِلّٰهِ شُهَدَاءَ بِالْقِسْطِ) – **ey iman gətirən şəxslər, şahidlik edəndə Allah-Təalanı düşünüb haqda sabit olub ədalətlə şahidlik edin. Hətta o şahidlik qohum-əqrəbanın zərərinə, düşmənin xeyrinə olsa da.** (وَلَا يَجْرِمَنَّكُمْ شَنَآنُ قَوْمٍ عَلَى أَلَّا تَعْدِلُوا) – **aranızda düşmənçilik olan qövmün ədavəti sizi buna vadar etməsin ki, onların haqqında ədalət etməyib şahidlikdə və ya başqa şeydə onlara zülm edəsiniz, əlbəttə, belə əməllər siz müsəlmanlara layiq deyil. Gərək hər bir qövmün haqqında ədalətli**

اعْدِلُوا هُوَ أَقْرَبُ لِلتَّقْوَى وَاتَّقُوا اللهَ إِنَّ اللهَ خَبِيرٌ بِمَا تَعْمَلُونَ ﴿٨﴾ وَعَدَ اللهُ الَّذِينَ آمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ لَهُمْ مَغْفِرَةٌ وَأَجْرٌ عَظِيمٌ ﴿٩﴾ وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِآيَاتِنَا أُولَئِكَ أَصْحَابُ الْجَحِيمِ
﴿١٠﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اذْكُرُوا نِعْمَةَ اللهِ عَلَيْكُمْ إِذْ هَمَّ قَوْمٌ أَنْ يَبْسُطُوا إِلَيْكُمْ أَيْدِيَهُمْ

---

**olasınız. (اعْدِلُوا هُوَ أَقْرَبُ لِلتَّقْوَى) – ədalətlə rəftar edin, möminlərin xüsusiyyəti olan ədalət təqvaya daha yaxındır. (وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ خَبِيرٌ بِمَا تَعْمَلُونَ) – Allah-Təaladan qorxub ədaləti* tərk etməyin və heç bir qövmə zülm etməyin. Həqiqətən, etdiyiniz hər bir şeydən Allah-Təala agah və xəbərdardır.**

*(*Qeyd:* *İslam dininin ehkamına fikir verilsin. Hətta müşrik və bütpərəstlər haqqında da ədalətlə rəftar etmək əmr edilir. Bəs necə demək olar ki, islamda yalandan şahidlik etmək, ya da başqa millətlərə zülm etməyə icazə var. Bu sözlər islama böyük böhtandır. Müsəlmanların islam qanunlarına əməl etməmələri islamın yaxşılığına zərər verməz. Ar olsun müsəlmanlara ki, Quranın hökmünü atıb az bir məbləğə dinlərini satıb, yalandan şahidlik edib, özgə millətlərin tənə etməsinə bais olurlar. Belə şəxsləri müsəlman saymamaq lazımdır. Peyğəmbərimiz buyurubdur: "Müsəlman o şəxsdir ki, xalq onun əlindən və dilindən əmin-amanlıqda olsun").*

**9) (وَعَدَ اللَّهُ الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) – iman gətirib saleh əməl edənlərə Allah-Təala vəd edibdir, (لَهُمْ مَغْفِرَةٌ وَأَجْرٌ عَظِيمٌ) – onlardan ötrü Allah-Təala yanında bağışlanmaq və böyük əcr və savab vardır.**

**10) (وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِآيَاتِنَا) – o şəxslər ki kafir olub bizim möcüzələrimizi təkzib ediblər, (أُولَئِكَ أَصْحَابُ الْجَحِيمِ) – onlar cəhənnəm yoldaşları və həmişə əzabda olanlardır.** (Hz. Peyğəmbərin savaşlarından biri Zi-Ənmar* savaşıdır. Hz. Peyğəmbər səhabələri ilə zöhr namazını qıldılar. Namazdan sonra müşriklər peşman oldular ki, gərək namaz üstündə hücum edib onları qətlə yetirəydik. Ondan sonra dedilər: "Bunların bir də əsr namazı var, o namazı atalarından və övladlarından çox istəyirlər. O namazı qılanda onları qətlə yetirərik". O vaxt Allah-Təala qorxu namazının hökmünü nazil etdi ki, namazı belə qılın. (Qorxu namazının ehkamı Nisa surəsinin 99-cu ayəsində keçmişdi. Oraya baxılsın). Hz. Peyğəmbər qorxu namazı şəklində namaz qıldı, Allah-Təala müşriklərin qəlbinə qorxu salıb, Hz. Peyğəmbər və səhabələri salamat qaldılar. Gələn ayədə Allah-Təala möminlərə düşməndən nicat vermə nemətini bəyan edir).

*(*Qeyd:* *Zi-Ənmar Ərəbistanda bir yerin adıdır).*

**11) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اذْكُرُوا نِعْمَةَ اللَّهِ عَلَيْكُمْ) – ey iman gətirən şəxslər, yadınıza salın Allah-Təalanın o nemətini ki, sizə bəxş edibdir. (إِذْ هَمَّ قَوْمٌ أَنْ يَبْسُطُوا إِلَيْكُمْ أَيْدِيَهُمْ) – Allah-Təalanın neməti budur: o zaman ki müşriklərdən bir camaat Zi-Ənmar savaşında niyyət etdilər ki, əllərini sizin tərəfinizə açıb namaz üstündə sizi qətlə yetirsinlər. (فَكَفَّ أَيْدِيَهُمْ عَنْكُمْ) – Allah-Təala**

فَكَفَّ أَيْدِيَهُمْ عَنْكُمْ وَاتَّقُوا اللَّهَ وَعَلَى اللَّهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ ﴿١١﴾ وَلَقَدْ أَخَذَ اللَّهُ مِيثَاقَ بَنِي إِسْرَائِيلَ وَبَعَثْنَا مِنْهُمُ اثْنَيْ عَشَرَ نَقِيبًا وَقَالَ اللَّهُ إِنِّي مَعَكُمْ لَئِنْ أَقَمْتُمُ الصَّلَاةَ وَآتَيْتُمُ الزَّكَاةَ وَآمَنْتُمْ بِرُسُلِي وَعَزَّرْتُمُوهُمْ وَأَقْرَضْتُمُ اللَّهَ قَرْضًا حَسَنًا لَأُكَفِّرَنَّ عَنْكُمْ سَيِّئَاتِكُمْ

---

**onların əllərini sizə zərər yetirməkdən saxladı. (وَاتَّقُوا اللَّهَ) – Allah-Təalanın nemətini yadınıza salın, Allah-Təaladan qorxub onun əmr və qadağalarına itaət edin. (وَعَلَى اللَّهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ) – möminlər hər bir işlərində, gərək, Allah-Təalaya təvəkkül etsinlər.** (Allah-Təala fironu həlak edəndən sonra Hz. Musaya əmr etdi ki, bəni-İsraili götürüb Şam mülkünə gedib orada məskun olan bütpərəstləri çıxarıb, bəni-İsraili orada məskun et. Bəni-İsrailin 12 tayfasından 12 nəfər vəkil və rəis seç. (Bəni-İsrail Yaqubun 12 oğlundan 12 tayfa idi). Ondan sonra onlardan möhkəm əhd-peyman al. Allah-Təalaya itaət edib itaətdən çıxmasınlar. Hz. Musa Allah-Təalanın əmrinə görə, bəni-İsraildən möhkəm əhd alıb, 12 nəfər vəkil təyin edib Şam tərəfinə yönəldilər. Şam mülkünə yaxınlaşanda 12 vəkilə əmr etdi ki, gedin bütpərəstlərdən bir xəbər gətirin (o bütpərəstlər Əmaliqa tayfasından idi). Orada gördüyünüz əhvalatı bəni-İsrailə xəbər verməyin. 12 nəfər vəkil Hz. Musanın əmri ilə Şam torpağına daxil olub bütpərəstləri çox qüvvətli və şövkətli görüb, onların əzəməti cüssələrindən qorxuya düşüb qayıdanda Hz. Musanın əmrindən çıxaraq gördüklərini bəni-İsrailə xəbər verib onları düşmənlə savaşmaqdan qorxutdular. Onlar da cənab Musanın itaətindən çıxdılar. 12 vəkildən ikisi bu xəbərləri öz tayfasına vermədi. Biri Yəhudanın nəslindən Kaleb ibn Yufənna, digəri Əfraim ibn Yusifin nəslindən Yuşa ibn Nun idi, gələn ayədə bu qissəyə işarə olunur).

**12) (وَلَقَدْ أَخَذَ اللَّهُ مِيثَاقَ بَنِي إِسْرَائِيلَ)** – (ey Məhəmməd)**, həqiqətən, Allah-Təala Musa vasitəsilə bəni-İsraildən möhkəm əhd aldı ki, Allaha itaətdən çıxmasınlar. (وَبَعَثْنَا مِنْهُمُ اثْنَيْ عَشَرَ نَقِيبًا) – ondan sonra Musaya buyurdu: bəni-İsraildən 12 nəfər rəisi 12 tayfalıq bəni-İsrailə təyin etdik, (وَقَالَ اللَّهُ إِنِّي مَعَكُمْ) – ondan sonra Allah-Təala buyurdu: "Ey bəni-İsrail, bilin və xəbərdar olun, həqiqətən, mən həmişə sizinlə birlikdəyəm. Heç vaxt sizdən* qafil deyiləm. Bütün əməllərinizdə məni düşünün. Yaxşı əməlləri tərk edib, pis əməllərə yönəlməyin. (لَئِنْ أَقَمْتُمُ الصَّلَاةَ وَآتَيْتُمُ الزَّكَاةَ) – ey bəni-İsrail, əgər siz namaz qılıb zəkat versəniz,** (bunlar dinin şüarıdır)**, (وَآمَنْتُمْ بِرُسُلِي وَعَزَّرْتُمُوهُمْ) – peyğəmbərlərimə iman gətirib imanınızda möhkəm olub mənim dinimi yaymaqda peyğəmbərlərimə kömək etsəniz, (وَأَقْرَضْتُمُ اللَّهَ قَرْضًا حَسَنًا) – Allah-Təala yolunda millətin övladları üçün malınızı sərf edib Allah-Təalaya borc versəniz, o borc əlbəttə, sizə yetişəcəkdir (hansı borcludur ki, Allah-Təaladan etibarlı olsun). (لَأُكَفِّرَنَّ عَنْكُمْ سَيِّئَاتِكُمْ) – əgər siz bu əməlləri etsəniz, mən də onların əvəzində sizin kiçik günahlarınızdan keçib tövbəsiz ba-**

وَلَأُدْخِلَنَّكُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ فَمَنْ كَفَرَ بَعْدَ ذَلِكَ مِنْكُمْ فَقَدْ ضَلَّ سَوَاءَ السَّبِيلِ ﴿١٢﴾
فَبِمَا نَقْضِهِمْ مِيثَاقَهُمْ لَعَنَّاهُمْ وَجَعَلْنَا قُلُوبَهُمْ قَاسِيَةً يُحَرِّفُونَ الْكَلِمَ عَنْ مَوَاضِعِهِ وَنَسُوا حَظًّا
مِمَّا ذُكِّرُوا بِهِ وَلَا تَزَالُ تَطَّلِعُ عَلَى خَائِنَةٍ مِنْهُمْ إِلَّا قَلِيلًا مِنْهُمْ فَاعْفُ عَنْهُمْ وَاصْفَحْ إِنَّ اللَّهَ يُحِبُّ
الْمُحْسِنِينَ ﴿١٣﴾ وَمِنَ الَّذِينَ قَالُوا إِنَّا نَصَارَى أَخَذْنَا مِيثَاقَهُمْ فَنَسُوا حَظًّا مِمَّا ذُكِّرُوا بِهِ

---

**ğışlayaram. (وَلَأُدْخِلَنَّكُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ) – əlbəttə, sizi ağaclarının və qəsrlərinin altından çaylar axan behişt bağlarına daxil edərəm. (فَمَنْ كَفَرَ بَعْدَ ذَلِكَ مِنْكُمْ) – sizdən kim bu şərtlərdən sonra kafir olsa, (فَقَدْ ضَلَّ سَوَاءَ السَّبِيلِ) – həqiqətən, asi olub düz yoldan kənara çıxıbdır.** (Bəni-İsrail Allah-Təalanın bu əhdinə əməl etməyib itaətdən çıxdılar)**.**

*(*****Qeyd:*** *Quranın bu hekayələrindən məqsəd sadəcə nəql etmək olmayıb, qayəsi öyüd-nəsihətdir. Müsəlmanlar, gərək, bu sözlərdən ibrət alıb Allah-Təalanın onlara baxıb nəzarət etdiyini nazir bilsinlər. Allah-Təalanı belə bilən şəxsdən insanlıqdan kənar əməllər necə peyda olar? Allah-Təalanın bu kəlamı buna işarədir ki, ey Quran əhli, bu sözlərdən ibrət alın, mən sizinlə birlikdəyəm. Sizin batininizə agaham. Gərək, qəlbinizi rəzil xüsusiyyətlərdən pak edib insanlıq xüsusiyyətində olasınız).*

**13) (فَبِمَا نَقْضِهِمْ مِيثَاقَهُمْ لَعَنَّاهُمْ) –** (ey Məhəmməd)**, bəni-İsrail əhdlərini pozub Allah-Təalanın itaətindən çıxdığına görə, onlara lənət edib rəhmətimizdən kənar etdik. (وَجَعَلْنَا قُلُوبَهُمْ قَاسِيَةً يُحَرِّفُونَ الْكَلِمَ عَنْ مَوَاضِعِهِ) – yenə əhdi pozduqlarına görə lütf və rəhmətimizi onlardan kəsdik, qəlbləri sərtləşib, Tövratın kəlmələrini, Allah-Təalanın vəhyini dəyişdirib, ona başqa yalan sözlərlə iftira etdilər. (وَنَسُوا حَظًّا مِمَّا ذُكِّرُوا بِهِ) – itaətdən çıxdıqları üçün Tövratda onlara Allah-Təala savabından vəd edilən böyük payı da yaddan çıxarıb tərk etdilər. (وَلَا تَزَالُ تَطَّلِعُ عَلَى خَائِنَةٍ مِنْهُمْ إِلَّا قَلِيلًا مِنْهُمْ) –** (ey Məhəmməd)**, əhdi pozmaq, itaətdən çıxmaq yəhudilərin adətidir. Bunların keçmiş zamanlardakı ata-babaları da peyğəmbərlərə xəyanət ediblər. İndi də bu yəhudilər sənə xəyanət edirlər. Müşriklərə kömək olub səninlə savaşmağa gətirirlər. Xəyanətkar yəhudilərdən agah olarsan. Yəhudilərin ancaq az bir qismi xəyanətkar olmayıb, sən onlardan xəyanət görməzsən. (فَاعْفُ عَنْهُمْ وَاصْفَحْ) –** (ey Məhəmməd)**, hərçənd bu yəhudilər sənə xəyanət edirlər, amma sən onların günahından keçib bağışlayıb intiqam alma. (إِنَّ اللَّهَ يُحِبُّ الْمُحْسِنِينَ) – həqiqətən, Allah-Təala yaxşılıq edən şəxsləri sevər.**

**14) (وَمِنَ الَّذِينَ قَالُوا إِنَّا نَصَارَى أَخَذْنَا مِيثَاقَهُمْ) – o şəxslər** (xristianlar) **ki, - həqiqətən, İsaya kömək olan bizik, dedilər. Onlardan da yəhudilər kimi möhkəm əhd aldıq ki, Allahın itaətində olub Tövrat və İncilə əməl etsinlər. (فَنَسُوا حَظًّا مِمَّا ذُكِّرُوا بِهِ) – onlar da yəhudilər kimi itaətdən çıxdıqları üçün Tövrat və İncildə Allah-Təala savabından onlara vəd edilən böyük paylarını yaddan çıxarıb tərk etdilər. (فَأَغْرَيْنَا بَيْنَهُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاءَ إِلَى يَوْمِ الْقِيَامَةِ) – itaətdən**

فَأَغْرَيْنَا بَيْنَهُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاءَ إِلَى يَوْمِ الْقِيَامَةِ وَسَوْفَ يُنَبِّئُهُمُ اللَّهُ بِمَا كَانُوا يَصْنَعُونَ ﴿١٤﴾ يَا أَهْلَ الْكِتَابِ قَدْ جَاءَكُمْ رَسُولُنَا يُبَيِّنُ لَكُمْ كَثِيرًا مِمَّا كُنْتُمْ تُخْفُونَ مِنَ الْكِتَابِ وَيَعْفُو عَنْ كَثِيرٍ قَدْ جَاءَكُمْ مِنَ اللَّهِ نُورٌ وَكِتَابٌ مُبِينٌ ﴿١٥﴾

---

**çıxdıqları* üçün qiyamətə kimi onların arasına ədavət və düşmənçilik saldıq,**

*(*Qeyd: Ah, yüz min dəfə heyif ki, Allah-Təala bu sözləri biz müsəlmanlara xəbər verir. Amma biz bundan qafilik ki, Allah-Təala bu sözləri kinayə ilə bizə buyurur. Yəni siz də əgər itaətdən çıxsanız, siz müsəlmanların arasına da xristianlar kimi böyük ədavət salaram. Bu sözlərin nəticəsi islam ümmətində peyda olubdur. O ixtilaf, ədavət və nifaq ki, bu gün islam ümmətinin arasında var, başqa heç bir millətdə yoxdur, hər kəs özündən bir məzhəb ixtira edib tamamən bir-birini təkfir edirlər. Birliyi və ittihadı əmr edən islam dinini neçə yerə bölüb parçalayıblar. Əfsus ki, bu gözəl islam dininin məhv olması səbəbi ilə islam ümməti bu mətləbdən bixəbər olub, bir-biriylə mücadiləylə məşğul olurlar. Allah, Allah, ey islam ümməti, ey müsəlmanlar, bir göz açıb dünyanın halına fikir verib, mücadiləni tərk edib hamınız "bütün müsəlmanlar qardaşdır" ayəsinin hikmətamiz məzmununun şərtinə görə bir-birinizlə qardaş kimi rəftar edin. Bu mübahisə və nifaqdan meydana gələn rəzalət və zəlalət, Allaha itaətdən çıxmaq əlaməti deyilmi?).*

**və məzhəblərində neçə firqə olub bir-birilərini təkfir etdilər. (وَسَوْفَ يُنَبِّئُهُمُ اللَّهُ بِمَا كَانُوا يَصْنَعُونَ) – əlbəttə, Allah-Təala itaətdən çıxanların əməllərini onlara xəbər verib, ondan sonra o əməllərinin cəzasını onlara verəcəkdir.**

**15) (يَا أَهْلَ الْكِتَابِ قَدْ جَاءَكُمْ رَسُولُنَا) – ey yəhudi və xristianlar, həqiqətən, peyğəmbərimiz** (Məhəmməd (s.ə.s) **sizə elə bir halda gəldi ki, (يُبَيِّنُ لَكُمْ كَثِيرًا مِمَّا كُنْتُمْ تُخْفُونَ مِنَ الْكِتَابِ) – sizin məxfi tutub gizlətdiyiniz Tövratın əksər hökmlərini sizdən ötrü bəyan edir və halbuki siz bilirsiniz ki,** (Hz. Məhəmməd) **Tövratı oxumayıb, agah deyildir. Bəs niyə ona iman gətirmirsiniz?** (Yəhudilər evlilərin zinası xüsusunda Tövratda olan rəcm – daşqalaq etmə cəzasını - inkar etdilər. Hz. Peyğəmbər buyurdu: "Yalan deyirsiniz, yəhudilərin böyük üləmasından Abdullah ibn Suriya mənimlə sizin aranızda hakim olsun". Yəhudilər qəbul etdilər. Abdullah ibn Suriya gəlib təsdiq etdi ki, Tövratda evlilərin zina cəzası rəcmdir. Bu məsələ həmin surənin bundan sonra gələn 45-ci ayəsinin təfsirindən sonra təfsilatı ilə qeyd olunacaqdır). **(وَيَعْفُو عَنْ كَثِيرٍ) – belə xəyal edirsiniz ki, agah deyil, gizlətdiyiniz şeylərin hamısından agahdır. Özü aşkar etməyib sizi sıxışdırmır. (قَدْ جَاءَكُمْ مِنَ اللَّهِ نُورٌ وَكِتَابٌ مُبِينٌ) – həqiqətən, Allah-Təaladan bir nur və açıq-aşkar möcüzə olan kitab** (Quran) **sizə gəlibdir. Gərək, onun nuruyla hidayət tapasınız** (onu inadkarlardan başqası inkar etməz)**.**

**16) (يَهْدِي بِهِ اللَّهُ مَنِ اتَّبَعَ رِضْوَانَهُ سُبُلَ السَّلَامِ) – Allah-Təala onun məmnunluğuna**

يَهْدِي بِهِ اللهُ مَنِ اتَّبَعَ رِضْوَانَهُ سُبُلَ السَّلَامِ وَيُخْرِجُهُمْ مِنَ الظُّلُمَاتِ إِلَى النُّورِ بِإِذْنِهِ وَيَهْدِيهِمْ
إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿١٦﴾ لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوا إِنَّ اللهَ هُوَ الْمَسِيحُ ابْنُ مَرْيَمَ قُلْ فَمَنْ يَمْلِكُ مِنَ
اللهِ شَيْئًا إِنْ أَرَادَ أَنْ يُهْلِكَ الْمَسِيحَ ابْنَ مَرْيَمَ وَأُمَّهُ وَمَنْ فِي الْأَرْضِ جَمِيعًا وَلِلهِ مُلْكُ السَّمَاوَاتِ
وَالْأَرْضِ وَمَا بَيْنَهُمَا يَخْلُقُ مَا يَشَاءُ وَاللهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٧﴾ وَقَالَتِ الْيَهُودُ وَالنَّصَارَى
نَحْنُ أَبْنَاءُ اللهِ وَأَحِبَّاؤُهُ

---

**tabe olan şəxsi bu Quranla salamat yola** (islama) **hidayət edər.** (وَيُخْرِجُهُمْ مِنَ الظُّلُمَاتِ إِلَى النُّورِ بِإِذْنِهِ) – **öz izin və yardımı ilə onları küfr zülmətlərindən iman nuruna tərəf çıxarar.** (وَيَهْدِيهِمْ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ) – **və onları axirət əzabından nicat verən düz yola hidayət edər.**

**17)** (لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوا إِنَّ اللهَ هُوَ الْمَسِيحُ ابْنُ مَرْيَمَ) – **Allah-Təala Məsih** (İsa) **Məryəm oğludur, deyənlər həqiqətən,* kafir oldular.** (قُلْ فَمَنْ يَمْلِكُ مِنَ اللهِ شَيْئًا إِنْ أَرَادَ أَنْ يُهْلِكَ الْمَسِيحَ ابْنَ مَرْيَمَ وَأُمَّهُ وَمَنْ فِي الْأَرْضِ جَمِيعًا) – (ey Məhəmməd), **de ki, əgər Allah-Təala İsa Məryəm oğlunu, onun anasını və bütün yer üzündə olan insanları həlak etmək istəsə** (necə ki həlak etdi),

*(****Qeyd:*** *Xristianlardan Allah-Təalanı birdəfəlik inkar edən heç bir qrup olmayıb. Əksinə, Allah-Təalanın əməllərini Hz. İsaya isnad edib, Məsihi Allah saydıqları üçün onları kafir hesab etdi. Çünki Allah-Təalaya məxsus sifətləri başqasına isnad etmək Allah-Təalanı inkar etmək kimidir və bu səbəbdən Allah-Təala onların küfrünə hökm verir. Biz müsəlmanlar Allah-Təalanın bütün işlərini nəinki peyğəmbərə və imamlara, hətta imamların övladlarına, fəqihlərə, sufilərə, hər bir dərdə dua yazanlara isnad edib, onlardan ehtiyacımıza çarə istəyib, dünya və axirət işlərində onlardan yardım tələb edirik. Allah-Təalanın bütün işlərində onları şərik, hətta müstəqil sayırıq. Xalqa zülm edib, adam öldürüb, onlara ağlamağı nicat səbəbi sayırıq. Görəsən, bizə müsəlman demək olarmı? Bəs bundan da böyük küfr və şirk olarmı? Allahım, haqdan ayrılmaqdan və azmaqdan sənə sığınıram!).*

**kim Allah-Təalanın qüdrət və iradəsinə mane olub onları qoruyar?** (Ey qüdrət və əzəmət sahibi, heç kim qadir olmayıb mühafizə edə bilmədi). (وَلِلهِ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَمَا بَيْنَهُمَا) – **səmaların və yerin səltənəti və yerlə səmaların arasında olan hər bir şey Allah-Təalaya məxsusdur.** (يَخْلُقُ مَا يَشَاءُ) – **Allah-Təala istədiyini yaradar** (ata-anasız Adəm kimi, atasız İsa kimi insan yaradar. Hamısı Allah-Təaladandır. Odur mütləq qüdrət sahibi, heç bir şey onun qüdrət əlindən kənar ola bilməz). (وَاللهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) – **Allah-Təala istədiyini yaratmağa qadirdir.** (Bəs yer üzündə olan müxtəlif məxluqlar Allah-Təalanın qüdrətinə işarə etmirmi? Kafirin gözü kor olsun).

**18)** (وَقَالَتِ الْيَهُودُ وَالنَّصَارَى نَحْنُ أَبْنَاءُ اللهِ وَأَحِبَّاؤُهُ) – **yəhudi və xristianlar dedilər: "Allah-Təalanın oğulları və dostları bizik,"** (yəhudilər Üzeyri, xristian-

قُلْ فَلِمَ يُعَذِّبُكُمْ بِذُنُوبِكُمْ بَلْ أَنْتُمْ بَشَرٌ مِمَّنْ خَلَقَ يَغْفِرُ لِمَنْ يَشَاءُ وَيُعَذِّبُ مَنْ يَشَاءُ وَلِلَّهِ مُلْكُ
السَّمَاوَاتِ وَالْأَرْضِ وَمَا بَيْنَهُمَا وَإِلَيْهِ الْمَصِيرُ ﴿١٨﴾ يَا أَهْلَ الْكِتَابِ قَدْ جَاءَكُمْ رَسُولُنَا يُبَيِّنُ لَكُمْ
عَلَى فَتْرَةٍ مِنَ الرُّسُلِ أَنْ تَقُولُوا مَا جَاءَنَا مِنْ بَشِيرٍ وَلَا نَذِيرٍ فَقَدْ جَاءَكُمْ بَشِيرٌ وَنَذِيرٌ وَاللَّهُ عَلَى
كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٩﴾ وَإِذْ قَالَ مُوسَى لِقَوْمِهِ يَا قَوْمِ اذْكُرُوا نِعْمَةَ اللَّهِ عَلَيْكُمْ إِذْ جَعَلَ فِيكُمْ أَنْبِيَاءَ

---

lar İsanı Allahın oğlu saydılar. O səbəbdən özlərinə də Allah-Təalanın oğlu dedilər. Bu mənada ki, Allah-Təalanın oğluna mənsub olmaq Allahın oğlu olmaq kimidir). **(قُلْ فَلِمَ يُعَذِّبُكُمْ بِذُنُوبِكُمْ)** – (ey Məhəmməd)**, onlara de ki, əgər doğru deyirsinizsə, Allah-Təalanın oğullarısınızsa, bəs niyə Allah-Təala sizə əzab edəcək? Ata oğlunu sevsə, əzab edərmi? (بَلْ أَنْتُمْ بَشَرٌ مِمَّنْ خَلَقَ) – əksinə, siz Allah-Təalanın yaratdığı məxluqatdan bir insan tayfasısınız.** (İnsan da digər heyvanlar kimi cismdir, yaşamaq üçün qidaya ehtiyacı var. Cism olan və qidaya ehtiyacı olan insan Allah-Təalanın oğlu ola bilməz). **(يَغْفِرُ لِمَنْ يَشَاءُ وَيُعَذِّبُ مَنْ يَشَاءُ) – Allah-Təala istədiyini** (itaətdə olanları) **bağışlayar və istədiyinə** (asilərə) **əzab edər. (وَلِلَّهِ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَمَا بَيْنَهُمَا) – səmaların və yerin səltənəti və onların arasında olan məxluqların hamısı Allah-Təalaya məxsusdur. (وَإِلَيْهِ الْمَصِيرُ) – məxluqatın qayıdacağı yer axirətdə Allah-Təala tərəfinədir. Öz əməllərinin cəzasını onlara yetirəcəkdir.**

**19) (يَا أَهْلَ الْكِتَابِ قَدْ جَاءَكُمْ رَسُولُنَا يُبَيِّنُ لَكُمْ عَلَى فَتْرَةٍ مِنَ الرُّسُلِ) – ey əhli-kitab, peyğəmbərin gəlib vəhyin nazil olması kəsilən bir zamanda bizim peyğəmbərimiz** (Hz. Məhəmməd) **sizə peyğəmbər gəldi ki, sizdən ötrü din və şəriət hökmlərini bəyan etsin.** (Hz. Məhəmməd (s.ə.s) ilə Hz. İsanın arasında 529 il fasilə olubdur). **(أَنْ تَقُولُوا مَا جَاءَنَا مِنْ بَشِيرٍ وَلَا نَذِيرٍ) – bu Hz. Məhəmmədi sizə peyğəmbər göndərdim. İstəmədim qiyamət günündə deyəsiniz ki, bizə nə müjdə verən, nə də bir qorxudan gəlmədi** (ki, ona tabe olaq. Bu səbəbə görə sizə peyğəmbər göndərdim ki, sizə olan dəlilim tamam olsun). **(فَقَدْ جَاءَكُمْ بَشِيرٌ وَنَذِيرٌ) – həqiqətən sizə müjdə verən və qorxudan** (Hz. Məhəmməd ə.s) **gəldi, qiyamət günündə daha bəhanəniz qalmaz. (وَاللَّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) – Allah-Təala hər bir şeyə qadirdir. Ehtiyac vaxtı, lazım olan zamanda peyğəmbər göndərər.**

**20) (وَإِذْ قَالَ مُوسَى لِقَوْمِهِ)** – (bu ayə və bundan sonra gələn ayələrdə Hz. Musanın əhvalatının qeyd olunmasında məqsəd kainatın fəxri olan Hz. Məhəmmədə təsəlli verməkdir. Yəni ey Məhəmməd, xalqın sənə itaət etməməsindən dilxor olma, Hz. Musanın qövmünə bax, gör ona nə qədər əziyyət verib, itaətdən çıxmışdılar. Ayənin mənası belədir, buyurur:) (ey Məhəmməd)**, yadına sal, o zaman ki Musa öz qövmünə dedi: (يَا قَوْمِ اذْكُرُوا نِعْمَةَ اللَّهِ عَلَيْكُمْ) – ey qövm, ey bəni-İsrail camaatı, Allah-Təalanın sizə bəxş etdiyi nemətlərini yadınıza salın,** (o nemətlər bunlardır:). **(إِذْ جَعَلَ فِيكُمْ أَنْبِيَاءَ) – Allah-Təala sizə üstünlük**

وَجَعَلَكُمْ مُلُوكًا وَآتَاكُمْ مَا لَمْ يُؤْتِ أَحَدًا مِنَ الْعَالَمِينَ ﴿٢٠﴾ يَا قَوْمِ ادْخُلُوا الْأَرْضَ الْمُقَدَّسَةَ
الَّتِي كَتَبَ اللَّهُ لَكُمْ وَلَا تَرْتَدُّوا عَلَى أَدْبَارِكُمْ فَتَنْقَلِبُوا خَاسِرِينَ ﴿٢١﴾ قَالُوا يَا مُوسَى إِنَّ فِيهَا قَوْمًا
جَبَّارِينَ وَإِنَّا لَنْ نَدْخُلَهَا حَتَّى يَخْرُجُوا مِنْهَا فَإِنْ يَخْرُجُوا مِنْهَا فَإِنَّا دَاخِلُونَ ﴿٢٢﴾ قَالَ رَجُلَانِ مِنَ
الَّذِينَ يَخَافُونَ أَنْعَمَ اللَّهُ عَلَيْهِمَا ادْخُلُوا عَلَيْهِمُ الْبَابَ فَإِذَا دَخَلْتُمُوهُ فَإِنَّكُمْ غَالِبُونَ

---

**verib, sizə özünüzdən peyğəmbərlər gətirdi.** (Heç bir xalqa bəni-İsrailə gələn qədər peyğəmbər gəlməyibdir)**.** **(**وَجَعَلَكُمْ مُلُوكًا**)** – ***qibtilərin əlində zəlil olandan sonra sizi padşah etdi.** **(**وَآتَاكُمْ مَا لَمْ يُؤْتِ أَحَدًا مِنَ الْعَالَمِينَ**)** – **Allah-Təala aləmlərdən heç kimə vermədiyi şeyləri siz bəni-İsrailə verdi,** (dənizi yarıb fironu qərq etmək, çöldə sizə bildirçin və halva göndərmək, Şam və Fələstin mülkündə Əmaliqaya hakim olmaq və bundan başqa böyük nemətlər verdi).

*(*Qeyd: Qədim Misir əhlinə qibti deyilir. İndi də Misirdə yaşayırlar).*

**21) (**يَا قَوْمِ ادْخُلُوا الْأَرْضَ الْمُقَدَّسَةَ الَّتِي كَتَبَ اللَّهُ لَكُمْ**)** – (Musa deyir:) **ey qövm, Allah-Təalanın sizdən ötrü yazıb təyin etdiyi müqəddəs və pak olan yerə** (Şam) **daxil olun. O yerlərdə sakin olan şəxslərdən qorxmayın.** **(**وَلَا تَرْتَدُّوا عَلَى أَدْبَارِكُمْ فَتَنْقَلِبُوا خَاسِرِينَ**)** – **zalım və kafirlərin qorxusundan geriyə dönüb qaçmayın, əgər geriyə qayıtsanız, dünya və axirətdə öz nəfsinizə ziyankar olarsınız** (çünki cihaddan qaçmaq caiz deyildir)**.**

**22) (**قَالُوا يَا مُوسَى إِنَّ فِيهَا قَوْمًا جَبَّارِينَ**)** – **bəni-İsrail Hz. Musanın cavabında dedi: "Ey Musa, Şam vilayətində qəddar və zalım bir qövm var, biz onlardan qorxuruq. Onlarla mücadilə etməyə taqətimiz yoxdur".** (Hz. Musanın Şamdan xəbər gətirmələri üçün göndərdiyi 12 nəfər vəkil qayıdıb gələndən sonra onların 10 nəfəri bəni-İsraili qorxutdu. Ona görə də bəni-İsrail Hz. Musaya qarşı çıxıb, savaşa getməkdən imtina etdi. Əvvəldə 14-cü ayədə qeyd olunmuşdu). **(**وَإِنَّا لَنْ نَدْخُلَهَا حَتَّى يَخْرُجُوا مِنْهَا**)** – **dedilər: "Ey Musa, orada olan zalım qövm oradan çıxana qədər, biz heç vaxt Şama daxil olmarıq,** **(**فَإِنْ يَخْرُجُوا مِنْهَا فَإِنَّا دَاخِلُونَ**)** – **əgər onlar Şamdan çıxsalar, əlbəttə, o zaman biz oraya daxil olarıq,"** (bəni-İsrailin bu sözü deməkdə məqsədi Şama daxil olmamaq idi, çünki onların öz ixtiyarları ilə Şamdan çıxmaları mümkün deyildi).

**23) (**قَالَ رَجُلَانِ مِنَ الَّذِينَ يَخَافُونَ أَنْعَمَ اللَّهُ عَلَيْهِمَا**)** –**Allah-Təalanın nemət verib dinlərində möhkəm olan və Ondan qorxan vəkillərdən iki kişi** (Kalib və Yuşa) **bəni-İsrailə dedilər*:** **(**ادْخُلُوا عَلَيْهِمُ الْبَابَ**)** – **"**(ey bəni-İsrail, o camaatdan qorxmayın, hərçənd onların qədd-qaməti ucadır, amma mənəviyyatları boş və qəlbsizdirlər. Onlardan qorxmayın). **Onların üstünə şəhərlərinin qapısından girin.** (Onlar sizə qarşı çıxa bilməzlər). **(**فَإِذَا دَخَلْتُمُوهُ فَإِنَّكُمْ غَالِبُونَ**)** – **şəhərin qapısından girdiyinizdə, əlbəttə, həqiqətən, siz onlara qalib olarsınız".**

وَعَلَى اللَّهِ فَتَوَكَّلُوا إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿٢٣﴾ قَالُوا يَا مُوسَى إِنَّا لَنْ نَدْخُلَهَا أَبَدًا مَا دَامُوا فِيهَا فَاذْهَبْ
أَنْتَ وَرَبُّكَ فَقَاتِلَا إِنَّا هَاهُنَا قَاعِدُونَ ﴿٢٤﴾ قَالَ رَبِّ إِنِّي لَا أَمْلِكُ إِلَّا نَفْسِي وَأَخِي فَافْرُقْ بَيْنَنَا
وَبَيْنَ الْقَوْمِ الْفَاسِقِينَ ﴿٢٥﴾ قَالَ فَإِنَّهَا مُحَرَّمَةٌ عَلَيْهِمْ أَرْبَعِينَ سَنَةً يَتِيهُونَ فِي الْأَرْضِ فَلَا تَأْسَ
عَلَى الْقَوْمِ الْفَاسِقِينَ ﴿٢٦﴾ وَاتْلُ عَلَيْهِمْ نَبَأَ ابْنَيْ آدَمَ بِالْحَقِّ

---

**(وَعَلَى اللَّهِ فَتَوَكَّلُوا إِنْ كُنْتُمْ مُؤْمِنِينَ) – əgər mömin olan şəxslərsinizsə, Allah-Təalaya təvəkkül edin.**

**24) (قَالُوا يَا مُوسَى إِنَّا لَنْ نَدْخُلَهَا أَبَدًا مَا دَامُوا فِيهَا) – bəni-İsrail dedi: "Ey Musa, nə qədər ki, o camaat oradadır, həqiqətən, biz heç vaxt ora daxil olmarıq. (فَاذْهَبْ أَنْتَ وَرَبُّكَ فَقَاتِلَا) –** (ey Musa)**, sən özün, bir də rəbbin Allah-Təala bir-birinizə kömək olub, gedin onlarla savaşın. (إِنَّا هَاهُنَا قَاعِدُونَ) – həqiqətən, biz burada əyləşirik, buradan heç bir tərəfə getmərik ki, görək sənin onlarla işin necə olacaq?"** (Bəni-İsrail inadkar, cahil və nadan bir qövm idi. Elə ki Hz. Musaya qarşı inad edib, küfr danışmağa başladılar, Musa və Harun hər ikisi səcdə edib, dua etdilər.

**25) (قَالَ رَبِّ إِنِّي لَا أَمْلِكُ إِلَّا نَفْسِي وَأَخِي) – Musa dedi: "Ey mənim rəbbim, həqiqətən, mən özüm və qardaşım Harundan başqa sənin dininə kömək etməyə malik deyiləm, heç kimə etimadım yoxdur. (فَافْرُقْ بَيْنَنَا وَبَيْنَ الْقَوْمِ الْفَاسِقِينَ) – bizimlə bu fasiq olan qövmün arasını ayırıb, bizim haqqımızda olan hökmü bizə, onların haqqında olan hökmü onlara ver".**

**26) (قَالَ فَإِنَّهَا مُحَرَّمَةٌ عَلَيْهِمْ أَرْبَعِينَ سَنَةً) – Allah-Təala buyurdu: "Onların hökmü budur ki, 40 il o müqəddəs torpağa daxil olmaq onlara haramdır. (يَتِيهُونَ فِي الْأَرْضِ) –** 40 **il çaşqın və sərgərdan olaraq yer üzündə dolanarlar. (فَلَا تَأْسَ عَلَى الْقَوْمِ الْفَاسِقِينَ) –** (ey Musa)**, bu fasiq olan qövmdən ötrü məhzun və qəmgin olma".** (Bəni-İsrail Allah-Təalanın hökmlərini qəbul etməyib Hz. Musaya etdikləri zülmləri səbəbi ilə o, üzgün olduğu üçün Allah-Təala ona təsəlli verir. Hz. Musa və Harunun çöldə vəfat etməsi təyin edildiyinə görə, buyurdu: bəni-İsrail 40 il biyabanda qalar, buyurmadı ki, siz də onlarla qalarsınız. 40 il bəni-İsrail həmin biyabanda qalıb heç bir tərəfə gedə bilmədilər. Qocaların hamısı çöldə həlak oldular. Hz. Musa və Harun da vəfat etdilər. Hz. Musa Yuşa ibn Nunu özünə varis təyin etdi. 40 ildən sonra Yuşa bəni-İsraili götürüb, müqəddəs torpağa (Şam mülkünə) daxil olub orada məskən saldılar. (Gələn ayədə Hz. Adəmin oğullarının xəbərini verməkdən məqsəd həsədin qəbahətini və ondan əmələ gələn fəsadları bəyan etməkdir).

**27) (وَاتْلُ عَلَيْهِمْ نَبَأَ ابْنَيْ آدَمَ بِالْحَقِّ) –** (ey Məhəmməd)**, Adəmin iki oğlunun xəbərini həqiqətdə olduğu kimi xalqa xəbər ver.** (Onların qissələri müxtəsər şəkildə belədir: Adəmin xanımı Həvva bir bətndə iki uşaq doğururdu. Bir

إِذْ قَرَّبَا قُرْبَانًا فَتُقُبِّلَ مِنْ أَحَدِهِمَا وَلَمْ يُتَقَبَّلْ مِنَ الْآخَرِ قَالَ لَأَقْتُلَنَّكَ قَالَ إِنَّمَا يَتَقَبَّلُ اللَّهُ مِنَ الْمُتَّقِينَ
﴿٢٧﴾ لَئِنْ بَسَطْتَ إِلَيَّ يَدَكَ لِتَقْتُلَنِي مَا أَنَا بِبَاسِطٍ يَدِيَ إِلَيْكَ لِأَقْتُلَكَ إِنِّي أَخَافُ اللَّهَ رَبَّ الْعَالَمِينَ
﴿٢٨﴾ إِنِّي أُرِيدُ أَنْ تَبُوءَ بِإِثْمِي وَإِثْمِكَ فَتَكُونَ مِنْ أَصْحَابِ النَّارِ

---

bətndən olan qızını o biri bətndən olan oğlu ilə evləndirirdilər. Oğlanlarından Habil və Qabili də elə etdi. Habil ilə birlikdə doğulan qızı Qabilə, Qabil ilə birlikdə doğulan qızı Habilə verdi. Qabil qəbul etmədi, çünki Qabil ilə birlikdə doğulan qız daha gözəl idi. Buyurdu: "Allah-Təaladan ötrü qurbanlıq aparın, kimin qurbanı qəbul olsa, o gözəl qız onun olsun". (Qurbanın qəbul olma əlaməti o idi ki, qəbul olan qurbanı səmadan od gəlib yandırardı). Habil heyvandar idi, yaxşı bir qoyun gətirdi, Qabil əkinçi idi, bir dəstə sünbül götürüb gəldi. Bir dağın üstündə qoydular. Səmadan od gəlib Habilin qurbanını yandırdı. Qabil razı olmadı. Fürsət tapıb Habili öldürdü. Tarixçilər qurban hadisəsini bu şəkildə qeyd ediblər. Bəlkə, də başqa cür olub, yer üzündə tökülən ilk insan qanı Habilin qanıdır. Həmin əhvalatı Allah-Təala ayədə xəbər verir). **(إِذْ قَرَّبَا قُرْبَانًا) –Adəmin iki oğlu Allah-Təaladan ötrü qurban apardığı zaman, (فَتُقُبِّلَ مِنْ أَحَدِهِمَا وَلَمْ يُتَقَبَّلْ مِنَ الْآخَرِ) – qurban onların birindən** (Habildən) **qəbul olundu, o birisindən** (Qabildən) **qəbul olunmadı. (قَالَ لَأَقْتُلَنَّكَ) – elə ki Qabil Habilin qurbanının qəbul olunduğunu gördü,** (həsəd odu onun sinəsində alovlanıb) **Habilə belə dedi: "Əlbəttə, səni qətlə yetirəcəyəm". (قَالَ إِنَّمَا يَتَقَبَّلُ اللَّهُ مِنَ الْمُتَّقِينَ) – Habil dedi: "Məni nədən ötrü qətlə yetirirsən? Sənin qurbanının qəbul olunmaması* nəfsinin xəbisliyindəndir".**

*(*Qeyd: Bəli, xəbis olan xüsusiyyətlər xəsislik, həsəd, təkəbbür, qürur, hirs, tamah, kin, ədavət, hiylə və bunlardan başqa təqvaya zidd olan rəzil nəfsani xüsusiyyətlərdir. Nə çox şəxs var ki, zahirdə təqva libasını geyinib, amma batini vəhşilik və heyvaniliklə doludur. )*

**Öz nəfsinə məzəmmət et və özündən ötrü təqvanı şüar edib, təqvanın ziddi olan həsədi özündən kənar et. Həqiqətən, Allah-Təala müttəqilərin hər bir əməlini qəbul edər.**

**28) (لَئِنْ بَسَطْتَ إِلَيَّ يَدَكَ لِتَقْتُلَنِي) – Habil dedi: "Əgər sən məni qətlə yetirmək üçün mənə əl qaldırsan da, (مَا أَنَا بِبَاسِطٍ يَدِيَ إِلَيْكَ لِأَقْتُلَكَ) – mən səni qətlə yetirmək üçün sənə əl qaldıran deyiləm. (إِنِّي أَخَافُ اللَّهَ رَبَّ الْعَالَمِينَ) – həqiqətən, mən aləmlərə tərbiyə verən rəbb Allah-Təaladan qorxub adam öldürməyə cəhd etmərəm".**

**29) (إِنِّي أُرِيدُ أَنْ تَبُوءَ بِإِثْمِي وَإِثْمِكَ)** – (ey Qabil), **mənim sənə əl qaldırmayıb, səni qətlə yetirməyə cəhd etməməkdə istəyim odur ki, sən məni qətlə yetirmək səbəbinə mənim günahlarımı və öz günahlarını da yüklənəsən.** (Belə ki mən də öz günahlarımdan azad olum). **(فَتَكُونَ مِنْ أَصْحَابِ النَّارِ) – o vaxt**

وَذَٰلِكَ جَزَاءُ الظَّالِمِينَ ﴿٢٩﴾ فَطَوَّعَتْ لَهُ نَفْسُهُ قَتْلَ أَخِيهِ فَقَتَلَهُ فَأَصْبَحَ مِنَ الْخَاسِرِينَ ﴿٣٠﴾
فَبَعَثَ اللَّهُ غُرَابًا يَبْحَثُ فِي الْأَرْضِ لِيُرِيَهُ كَيْفَ يُوَارِي سَوْأَةَ أَخِيهِ قَالَ يَا وَيْلَتَا أَعَجَزْتُ أَنْ أَكُونَ
مِثْلَ هَٰذَا الْغُرَابِ فَأُوَارِيَ سَوْأَةَ أَخِي فَأَصْبَحَ مِنَ النَّادِمِينَ ﴿٣١﴾ مِنْ أَجْلِ ذَٰلِكَ كَتَبْنَا عَلَىٰ بَنِي
إِسْرَائِيلَ أَنَّهُ مَنْ قَتَلَ نَفْسًا بِغَيْرِ نَفْسٍ أَوْ فَسَادٍ فِي الْأَرْضِ فَكَأَنَّمَا قَتَلَ النَّاسَ جَمِيعًا

---

**da o günahların səbəbinə cəhənnəm odunda əzab edilənlərdən olasan.** (Amma mən nicat tapanlardan olum). **(وَذَٰلِكَ جَزَاءُ الظَّالِمِينَ) – cəhənnəm odunda əzab edilmək zalımların cəzasıdır.**

**30) (فَطَوَّعَتْ لَهُ نَفْسُهُ قَتْلَ أَخِيهِ) – Qabil Habilin sözlərinə qulaq asmayıb, nəfsi qardaşı Habili qətl etməyi ona asanlaşdırdı. (فَقَتَلَهُ فَأَصْبَحَ مِنَ الْخَاسِرِينَ) – nəfsinə aldanıb, qardaşı Habili qətlə yetirib, dünya və axirətdə ziyankar şəxslərdən oldu.** (Habil yatan zaman fürsət tapıb böyük bir daşı başına salıb onu qətlə yetirdi. Ondan sonra onun cəsədi ilə nə edəcəyini bilmədi. Allah-Təala Habilin cəsədinin o şəkildə qalmasına razı olmadı. Bir-biri ilə dalaşan iki qarğa göndərib, biri o birisini qətlə yetirdi. Ondan sonra caynaqları və dimdikləri ilə yeri qazıb onu dəfn etdi. Qabil də ondan dəfn etmə adətini öyrənib, Habili dəfn etdi. Mövlana Cəlaləddin Rumi bu mətləbə işarət edib deyir: "Qardaş öldürmək kimi bu iyrənc cinayətin səbəbi həsəd etməkdir. Həsəd bu qədər iyrənc bir xüsusiyyətdir. Həsəd edib qardaşını öldürən insana da heç insan deyilərmi?". Necə ki ayədə buyurur).

**31) (فَبَعَثَ اللَّهُ غُرَابًا يَبْحَثُ فِي الْأَرْضِ) – elə ki Qabil çaşqın qalıb, qardaşı Habilin cəsədi ilə nə edəcəyini bilmədi, Allah-Təala bir qarğa göndərdi, o qarğa gəlib Qabilin onu gördüyü yerdə durdu, caynaqları və dimdiyi ilə yeri qazmağa başladı,** (qazandan sonra ölü qarğanı ora salıb üstünə torpaq tökdü. Qarğanın bu əməlindən Qabil anladı ki, Habili, gərək, yerdə dəfn etsin). **(لِيُرِيَهُ كَيْفَ يُوَارِي سَوْأَةَ أَخِيهِ) – Allah-Təala qarğanı ona görə yolladı ki, Qabilə qardaşının bədənini necə basdırmasını göstərsin.(قَالَ يَا وَيْلَتَا أَعَجَزْتُ أَنْ أَكُونَ مِثْلَ هَٰذَا الْغُرَابِ فَأُوَارِيَ سَوْأَةَ أَخِي) – elə ki Qabil qarğanın əməlini gördü, dedi: "Vay olsun mənə, bəs mən bu qarğa kimi də olub qardaşımın cəsədini basdırmaqdan acizəm?"** (Ondan sonra Habili dəfn etdi). **(فَأَصْبَحَ مِنَ النَّادِمِينَ) – artıq peşman olanlardan olmuşdu.** (Qabilin bu əməli həsəd səbəbi ilə oldu, nə pis xüsusiyyətdir həsəd. Elə olur ki, adam öz əziz olan qardaşını da həsəddən qətlə yetirir. Bəs belə şəxsə insan deyilərmi?).

**32) (مِنْ أَجْلِ ذَٰلِكَ) – Adəm övladının etdiyi bu qətl səbəbilə, (كَتَبْنَا عَلَىٰ بَنِي إِسْرَائِيلَ) – bəni-İsrailə yazıb hökm etdik ki, (أَنَّهُ مَنْ قَتَلَ نَفْسًا بِغَيْرِ نَفْسٍ أَوْ فَسَادٍ فِي الْأَرْضِ فَكَأَنَّمَا قَتَلَ النَّاسَ جَمِيعًا) – həqiqətən, kim adam öldürməyən, müşrik olmayan və yol kəsib yer üzündə fəsad törətməyən bir şəxsi qətlə yetirsə,**

وَمَنْ أَحْيَاهَا فَكَأَنَّمَا أَحْيَا النَّاسَ جَمِيعًا وَلَقَدْ جَاءَتْهُمْ رُسُلُنَا بِالْبَيِّنَاتِ ثُمَّ إِنَّ كَثِيرًا مِنْهُمْ بَعْدَ ذَلِكَ فِي الْأَرْضِ لَمُسْرِفُونَ ﴿٣٢﴾ إِنَّمَا جَزَاءُ الَّذِينَ يُحَارِبُونَ اللَّهَ وَرَسُولَهُ وَيَسْعَوْنَ فِي الْأَرْضِ فَسَادًا أَنْ يُقَتَّلُوا أَوْ يُصَلَّبُوا أَوْ تُقَطَّعَ أَيْدِيهِمْ وَأَرْجُلُهُمْ مِنْ خِلَافٍ أَوْ يُنْفَوْا مِنَ الْأَرْضِ ذَلِكَ لَهُمْ خِزْيٌ فِي الدُّنْيَا وَلَهُمْ فِي الْآخِرَةِ عَذَابٌ عَظِيمٌ ﴿٣٣﴾ إِلَّا الَّذِينَ تَابُوا مِنْ قَبْلِ أَنْ تَقْدِرُوا عَلَيْهِمْ

---

(çünki adam öldürənin, müşrik və yol kəsən quldurun qətli vacibdir), **sanki, dünyada olan bütün insanları öldürmüş kimi olar.** (Yəni Allah-Təala bir adam öldürənə bütün insanları öldürmüş qədər əzab edər, qatilə nicat yoxdur, tövbəsi də qəbul edilməz). **(وَمَنْ أَحْيَاهَا فَكَأَنَّمَا أَحْيَا النَّاسَ جَمِيعًا) – amma kim bir insanı ölməkdən xilas etsə, sanki, o şəxs bütün insanları ölümdən xilas edib təzə həyat vermiş kimi olar. (وَلَقَدْ جَاءَتْهُمْ رُسُلُنَا بِالْبَيِّنَاتِ) – həqiqətən, bizim peyğəmbərlərimiz adam öldürmənin haram olması haqda açıq-aşkar dəlillərlə bəni-İsrailə gəldilər.** (ثُمَّ إِنَّ كَثِيرًا مِنْهُمْ بَعْدَ ذَلِكَ فِي الْأَرْضِ لَمُسْرِفُونَ) **– peyğəmbərlər gəlib adam öldürməyin haram olmasını onlara bildirəndən sonra yenə bəni-İsraildən bir çoxu yer üzündə fəsad törədib, qan tökməklə Allah-Təalaya asi oldular.**

**33)** (إِنَّمَا جَزَاءُ الَّذِينَ يُحَارِبُونَ اللَّهَ وَرَسُولَهُ وَيَسْعَوْنَ فِي الْأَرْضِ فَسَادًا) **– həqiqətən, o şəxslər ki Allah-Təala ilə və onun peyğəmbərləri ilə savaşıb, onlara itaət etmirlər və yer üzündə fəsad törədib, yol kəsib yolda gəlib-gedənin malını alırlar, onların barəsindəki hökm budur: (أَنْ يُقَتَّلُوا أَوْ يُصَلَّبُوا)** – (əgər o yol kəsənlər adam öldürüb malını aparmasalar) **gərək öldürülsünlər,** (əgər adam öldürüb, mallarını da aparsalar)**, onlar gərək asılaraq öldürülsünlər. (أَوْ تُقَطَّعَ أَيْدِيهِمْ وَأَرْجُلُهُمْ مِنْ خِلَافٍ) – (əgər malı aparıb, adam öldürməsələr), o vaxt da gərək onların əlləri və ayaqları müxtəlif şəkildə** (sağ ayaqla sol əli, ya da sol ayaqla sağ əli) **kəsilsin. (أَوْ يُنْفَوْا مِنَ الْأَرْضِ) – əgər adam öldürməyib, mallarını da aparmayıb, ancaq gəlib-gedənləri qorxutsalar, o vaxt gərək onları tutub yurdlarından sürgün etsinlər** (yəni öz vilayətlərindən özgə vilayətə göndərsinlər. Bu dövrdə sultanlar arasında adət olan sürgün cəzası Quranın bu hökmündəndir)**. (ذَلِكَ لَهُمْ خِزْيٌ فِي الدُّنْيَا) – bu qeyd olunan əzablar o yol kəsənlər üçün dünyada zillətdir. (وَلَهُمْ فِي الْآخِرَةِ عَذَابٌ عَظِيمٌ) – onlardan ötrü axirətdə böyük əzab vardır.**

**34) (إِلَّا الَّذِينَ تَابُوا مِنْ قَبْلِ أَنْ تَقْدِرُوا عَلَيْهِمْ) – bu qeyd olunan hökmlər yol kəsənlərdən ötrü sabitdir. Ancaq o şəxslər ki siz onları ələ keçirib, onları tutmanızdan qabaq tövbə etsələr, o zaman sizin onlara əziyyət etməyə heç bir ixtiyarınız yoxdur.** (Amma əgər adam öldürsələr, onun ixtiyarı öldürülənin varisindədir. İstəsə, qisas alar, istəsə, bağışlayar. Tövbə qisası eti-

فَاعْلَمُوا أَنَّ اللّهَ غَفُورٌ رَحِيمٌ ﴿٣٤﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللّهَ وَابْتَغُوا إِلَيْهِ الْوَسِيلَةَ وَجَاهِدُوا فِي
سَبِيلِهِ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٣٥﴾ إِنَّ الَّذِينَ كَفَرُوا لَوْ أَنَّ لَهُمْ مَا فِي الْأَرْضِ جَمِيعًا وَمِثْلَهُ مَعَهُ لِيَفْتَدُوا
بِهِ مِنْ عَذَابِ يَوْمِ الْقِيَامَةِ مَا تُقُبِّلَ مِنْهُمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٣٦﴾ يُرِيدُونَ أَنْ يَخْرُجُوا مِنَ النَّارِ وَمَا
هُمْ بِخَارِجِينَ مِنْهَا وَلَهُمْ عَذَابٌ مُقِيمٌ ﴿٣٧﴾ وَالسَّارِقُ وَالسَّارِقَةُ فَاقْطَعُوا أَيْدِيَهُمَا

---

barsız etməz). **(فَاعْلَمُوا أَنَّ اللّهَ غَفُورٌ رَحِيمٌ) – bilin ki, həqiqətən, Allah-Təala sizə rəhm edib bağışlayandır. Siz də tövbə edən şəxsi bağışlayın.**

**35) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللّهَ) – ey iman gətirən şəxslər, Allah-Təaladan qorxub haram şeyləri tərk edin. (وَابْتَغُوا إِلَيْهِ الْوَسِيلَةَ) – itaət və ibadət etməklə Allah-Təalaya yaxınlaşmağı istəyin. (وَجَاهِدُوا فِي سَبِيلِهِ) – Allah-Təala yolunda cihad* edin. (لَعَلَّكُمْ تُفْلِحُونَ) – əlbəttə, qeyd olunan əməlləri edəndən sonra axirət əzabından nicat taparsınız,** (amma əməlsiz nicata ümid etmək çöldə əkini olmayıb, amma əkin sahibi kimi məhsul sahibi olmağı ümid etmək kimi axmaqlıq və səfehlik əlamətidir).

*(*__Qeyd:__ Cihad etmək sadəcə müşriklərlə savaşıb ölməkdən ibarət deyil. Əksinə, islamı yaymaq üçün hər bir zəhmətə qatlanmaq böyük cihaddır. Hz. Peyğəmbərin hədisi bu mətləbə işarədir. Bir dəfə cihaddan qayıdıb Mədinəyə qayıdırdı. Buyurdu: "Kiçik cihaddan böyük cihada qayıtdıq". Öyüd-nəsihət ilə xalqı islama daxil edib, həmişə islam ümmətinin tərəqqisi yolunda çalışmaq və ümmətin övladları yolunda, din və məzhəbin tərəqqisi üçün var-dövlət xərcləyib, islamı yaymaq böyük cihaddır. Zənginlər buna diqqət etsinlər).*

**36) (إِنَّ الَّذِينَ كَفَرُوا لَوْ أَنَّ لَهُمْ مَا فِي الْأَرْضِ جَمِيعًا وَمِثْلَهُ مَعَهُ) – həqiqətən, Quranı inkar edənlər, əgər yer üzündə olan hər bir şeyə və bir o qədərə də malik olub, (لِيَفْتَدُوا بِهِ مِنْ عَذَابِ يَوْمِ الْقِيَامَةِ) – qiyamət gününün əzabından xilas olmaq üçün onları versələr, (مَا تُقُبِّلَ مِنْهُمْ) – onlardan qəbul olunmaz, (وَلَهُمْ عَذَابٌ أَلِيمٌ) – onlardan ötrü şiddətli əzab vardır.**

**37) (يُرِيدُونَ أَنْ يَخْرُجُوا مِنَ النَّارِ) – cəhənnəm odunun əzabından xaric olub xilas olmaq istəyərlər, (وَمَا هُمْ بِخَارِجِينَ مِنْهَا) – halbuki cəhənnəm əzabından çıxan deyillər. (وَلَهُمْ عَذَابٌ مُقِيمٌ) – onlardan ötrü həmişəlik əzab vardır. Heç vaxt o əzabdan xilas ola bilməzlər.** (Sıradakı ayə oğurluq hökmünün bəyanı haqqındadır).

**38) (وَالسَّارِقُ وَالسَّارِقَةُ فَاقْطَعُوا أَيْدِيَهُمَا) – oğurluq* edən kişi və qadının hər ikisinin əllərini kəsin.**

(***Qeyd:** *Oğurluğun cəzası şəriətdə belədir: birinci dəfə oğrunun sağ əli barmaqlarının oynaq yerindən kəsilər. (Əmirəl-möminin Hz. Əli bu şəkildə kəsmişdi (Kuleyni, Kafi (Furu), II/300-301; Tusi, Təhzib, X/103-102), belə buyurubdur: barmaqlarının o tərəfi gərək qalsın ki, onunla həyatını davam etdirə bilsin), əgər ikinci dəfə oğurluq etsə,*

جَزاءً بِما كَسَبا نَكالًا مِنَ اللهِ وَاللهُ عَزيزٌ حَكيمٌ ﴿٣٨﴾ فَمَنْ تابَ مِنْ بَعْدِ ظُلْمِه وَأَصْلَحَ فَإِنَّ اللهَ يَتُوبُ عَلَيْهِ إِنَّ اللهَ غَفورٌ رَحيمٌ ﴿٣٩﴾ أَلَمْ تَعْلَمْ أَنَّ اللهَ لَهُ مُلْكُ السَّماواتِ وَالْأَرْضِ يُعَذِّبُ مَنْ يَشاءُ وَيَغْفِرُ لِمَنْ يَشاءُ وَاللهُ عَلى كُلِّ شَيْءٍ قَديرٌ ﴿٤٠﴾ يا أَيُّهَا الرَّسُولُ لا يَحْزُنْكَ الَّذينَ يُسارِعُونَ فِي الْكُفْرِ مِنَ الَّذينَ قالُوا آمَنّا بِأَفْواهِهِمْ وَلَمْ تُؤْمِنْ قُلوبُهُمْ

---

*həmin şəxsin əliylə baldırdan aşağı sol ayağı da oynağından kəsilər, əgər 3-cü dəfə oğurluq etsə, əli və ayağı kəsilməkdən əlavə ömürlük həbs də edilər (Kuleyni, Kafi (Furu), II/312; Tusi, Təhzib, X/99; İstibsar, IV/312). Əgər həbsdən qaçıb yenə oğurluq etsə, o vaxt onun qətli vacibdir. Oğrunun əlinin kəsilməsinə səbəb olan şeyin miqdarı bir misqal qızılın dörddə bir hissəsi qədərdir. Elə ki oğurlanan şeyin miqdarı bir misqal qızılın dörtdən bir hissə qədər özü, ya da qiyməti oldu, o vaxt gərək oğrunun əli kəsilsin. İmamiyyə (şiə) üləmasının fitvası budur. İmam Malik və imam Şafi də belə fitva veriblər. Amma imam Əbu Hənifə deyibdir: “10 dirhəm qədər gərək olsun”. Həsən Bəsri deyibdir: “Bir dirhəm qədər də olsa, əli kəsilməlidir və oğurlanan şey də gərək möhkəm yerdə - sandıq içində, cibdə, ya da başqa bir yerdə gizlənmiş olsun”. Amma zahir və aşkarda olan şey oğurlansa, hətta qiymətli şey də olsa, o zaman əl kəsmək caiz deyil, oğruya tənbeh olunub, bir o qədər cəza verilər).*

**(جَزاءً بِما كَسَبا نَكالًا مِنَ اللهِ) – oğru kişinin və qadının əllərinin kəsilməsi öz əməllərinin cəzasıdır. Allah-Təala tərəfindən onlara əzab təyin edilibdir. (وَاللهُ عَزيزٌ حَكيمٌ) – Allah-Təala məxluqata qalibdir və hikmət üzrə onlardan ötrü ehkamlar verər.**

**39) (فَمَنْ تابَ مِنْ بَعْدِ ظُلْمِهِ وَأَصْلَحَ) – kim oğurluqdan sonra tövbə edib yaxşı əməllər etsə, (فَإِنَّ اللهَ يَتُوبُ عَلَيْهِ) – həqiqətən, Allah-Təala onun tövbəsini qəbul edər, (إِنَّ اللهَ غَفورٌ رَحيمٌ) - həqiqətən, Allah-Təala tövbə edənləri bağışlayıb rəhm edəndir.** (Tövbə axirət əzabından saxlayar, amma əl kəsilmək cəzası tövbə ilə hökmsüz olmaz. Gərək kəsilsin).

**40) (أَلَمْ تَعْلَمْ أَنَّ اللهَ لَهُ مُلْكُ السَّماواتِ وَالْأَرْضِ)** – (ey insan)**, bəs bilmirsən ki, həqiqətən, səmaların və yerin səltənəti Allah-Təalaya məxsusdur? (يُعَذِّبُ مَنْ يَشاءُ وَيَغْفِرُ لِمَنْ يَشاءُ) – istədiyinə** (asilərə) **əzab edər və istədiyini** (tövbə edənləri) **bağışlayar, (وَاللهُ عَلى كُلِّ شَيْءٍ قَديرٌ) – Allah-Təala hər bir şeyə qadirdir.**

**41) (يا أَيُّهَا الرَّسُولُ لا يَحْزُنْكَ الَّذينَ يُسارِعُونَ فِي الْكُفْرِ)** – (Allah-Təala bu ayədə peyğəmbərin hörməti və şərəfi naminə o həzrətin adını qeyd etməyib, “ey rəsul” şəklində xitab edir. Neçə yerdə də “ey nəbi” buyurubdur. Amma “ey rəsul” xitabı iki yerdədir. Biri budur. Digəri də 6-cı cüzün sonundakı “Ey rəsul! Sənə nazil ediləni təbliğ et!” ayəsidir. Bu ayə münafiqlər barəsindədir. Buyurur:) ey peyğəmbər, o şəxslər ki kafir və müşriklərlə qarşılaşanda küfrlərini tez izhar edirlər, onların bu əməlləri səni məhzun və qəmgin etməsin. Münafiqlər həmişə belə olurlar. (مِنَ الَّذينَ قالُوا آمَنّا بِأَفْواهِهِمْ وَلَمْ تُؤْمِنْ قُلوبُهُمْ) – **küfrlərini izhar**

وَمِنَ الَّذِينَ هَادُوا سَمَّاعُونَ لِلْكَذِبِ سَمَّاعُونَ لِقَوْمٍ آخَرِينَ لَمْ يَأْتُوكَ يُحَرِّفُونَ الْكَلِمَ مِنْ بَعْدِ مَوَاضِعِهِ يَقُولُونَ إِنْ أُوتِيتُمْ هَذَا فَخُذُوهُ وَإِنْ لَمْ تُؤْتَوْهُ فَاحْذَرُوا وَمَنْ يُرِدِ اللَّهُ فِتْنَتَهُ فَلَنْ تَمْلِكَ لَهُ مِنَ اللَّهِ شَيْئًا

---

**edən bu münafiqlər o şəxslərdirlər ki, ağızları ilə - iman gətirmişik dedilər, amma qəlbləri iman gətirməyibdir.** (Ey Məhəmməd, münafiqin xüsusiyyəti budur. Nə vaxt səni görsələr, iman izharı edərlər. Amma müşrikləri görəndə şad olub onlara deyərlər: “Biz sizinlə birlikdəyik, heç vaxt iman gətirməmişik”).* **(وَمِنَ الَّذِينَ هَادُوا سَمَّاعُونَ لِلْكَذِبِ) -**

*(***Qeyd:** Bu ayə, sanki, biz islam ümmətinin bu dövrdəki əhvalını bəyan edir, bu zamanda islam ümməti cəhalət xəstəliyinə düçar olduğundan Quranın ziddini deyənlərə qulaq asıb, onların sözlərini qəbul etməkdə yəhudilər kimi olublar. Demək olar ki, Quranın hökmü islam ümmətinin arasından birdəfəlik götürülüb, yalan və aldadıcı hədisləri peyğəmbərə və imamlara isnad verib, onlarla xalqı məmnun edib, Allah-Təalanın kitabını tərk ediblər. Mən həqir müəllifin bu təfsir kitabını türk dilində yazmaqda məqsədi odur ki, türkdilli müsəlmanlar Quranın mənasını öz dillərində oxuyub dərk etsinlər ki, Qurana xilaf olan yalan sözlərə qulaq asmasınlar, Qurana xilaf olan sözləri hər bir məkanda, hər bir məqamda bəyan etmişəm. Müvəffəq edən Allahdır).*

**- Yəhudilərdən yalan sözə qulaq asan bəzi şəxslər vardır. Onların alimləri Tövratın mənasını dəyişdirib, Allah-Təalaya böhtan və iftira atıb, onlara** (adi yəhudilərə) **yalan sözlər deyərlər ki, onları özlərinə tabe edib dünya mənfəəti qazansınlar. Yəhudilər də alimlərin yalan sözlərinə aldanıb qəbul edərlər.** (Bu ayə hər bir sözü təqlidlə qəbul etməyi məzəmmət edir)**. (سَمَّاعُونَ لِقَوْمٍ آخَرِينَ لَمْ يَأْتُوكَ)** – (ey Məhəmməd)**, yenə o yəhudilər sənin hüzuruna gəlməyən başqa yəhudi camaatının sözlərinə qulaq asarlar, (qulaq asan yəhudilər bəni-Qüreyzə yəhudiləri idi, Hz. Peyğəmbər onlarla əhd etmişdi ki, xəyanət etməsinlər, amma onlar Xeybər yəhudilərinin sözlərinə qulaq asırdılar. Xeybər yəhudiləri onları əhdi pozub, peyğəmbərə xəyanət etməyə vadar etdilər. Onlar da xəyanət edib əhdi pozdular). (يُحَرِّفُونَ الْكَلِمَ مِنْ بَعْدِ مَوَاضِعِهِ)** – **onların üləmaları Tövratda olan Allah-Təala kəlamının yerini dəyişdirib, onlara başqa mənalar verirdilər. (يَقُولُونَ إِنْ أُوتِيتُمْ هَذَا فَخُذُوهُ)** – (bəni-Qüreyzə yəhudilərinə) **dedilər: əgər** (Məhəmməd) **sizə biz deyən bu sözləri desə, ondan qəbul edin. (وَإِنْ لَمْ تُؤْتَوْهُ فَاحْذَرُوا)** – **əgər bu sözləri sizə deməyib başqa sözlər desə, çəkinin, o sözlərə qulaq asmayın.** (Onun sözləri batil və asi edən sözlərdir)**. (وَمَنْ يُرِدِ اللَّهُ فِتْنَتَهُ فَلَنْ تَمْلِكَ لَهُ مِنَ اللَّهِ شَيْئًا)** – (ondan sonra Allah-Təala o yəhudilərin vəsfini göstərir:) (ey Məhəmməd)**, Allah-Təala öz lütf və mərhəmətini öz xəbis əməlinə görə kimdən kəsib, onun zəlalətdə qalmasını istəsə, o şəxs həmişə zəlalətdə qalacaqdır.** (ey Məhəmməd)**, sən**

أُولَئِكَ الَّذِينَ لَمْ يُرِدِ اللَّهُ أَنْ يُطَهِّرَ قُلُوبَهُمْ لَهُمْ فِي الدُّنْيَا خِزْيٌ وَلَهُمْ فِي الْآخِرَةِ عَذَابٌ عَظِيمٌ
﴿٤١﴾ سَمَّاعُونَ لِلْكَذِبِ أَكَّالُونَ لِلسُّحْتِ فَإِنْ جَاءُوكَ فَاحْكُمْ بَيْنَهُمْ أَوْ أَعْرِضْ عَنْهُمْ وَإِنْ تُعْرِضْ
عَنْهُمْ فَلَنْ يَضُرُّوكَ شَيْئًا وَإِنْ حَكَمْتَ فَاحْكُمْ بَيْنَهُمْ بِالْقِسْطِ إِنَّ اللَّهَ يُحِبُّ الْمُقْسِطِينَ ﴿٤٢﴾

---

**o şəxsdən ötrü heç bir şeyə malik deyilsən ki, Allah-Təala tərəfindən o şəxsi hidayətə gətirəsən. (أُولَئِكَ الَّذِينَ لَمْ يُرِدِ اللَّهُ أَنْ يُطَهِّرَ قُلُوبَهُمْ) - bu yəhudilər o şəxslərdir ki Allah-Təala pis əməllərinə görə onların qəlblərini pak və münəzzəh etmək istəməyibdir,** (ki, hidayət tapıb, islam dininə daxil olsunlar). **(لَهُمْ فِي الدُّنْيَا خِزْيٌ) - onlardan ötrü dünyada zillət vardır. Yəhudilər, gərək, həmişə zəlil olsunlar.** (Bu xəbərdən 1320 il keçibdir, bu zamana qədər də bu xəbər doğru olub. Hansı ölkədə yəhudi varsa, hamısı zillət içindədir). **(وَلَهُمْ فِي الْآخِرَةِ عَذَابٌ عَظِيمٌ) - axirətdə onlardan ötrü böyük əzab vardır.** (Xeybərdə evli olan məşhur bir yəhudi qadınla bir kişi zina etdilər. Tövratda evlilərin zina cəzası rəcm (daşqalaq edilmək) idi. Onlara rəcm cəzası vermək istəmədilər. Zinakarları bir neçə nəfərlə Mədinəyə - bəni-Qüreyzə yəhudilərinin yanına göndərib dedilər: "Bunları peyğəmbərin hüzuruna aparın, soruşun ki, bunların cəzası nədir? Əgər - rəcmdir, desə, qəbul etməyin. Əgər – qamçılanmaqdır, desə, qəbul edin". Hz. Peyğəmbərin hüzuruna gəldilər. Hz. Peyğəmbər buyurdu: "Onların cəzası Tövratda olduğu kimi rəcmdir". Onlar inkar etdilər ki, Tövratda belə hökm yoxdur. Hz. Peyğəmbər buyurdu: "Fədəkdə olan cavan alim Abdullah ibn Suriyanı tanıyırsınız?" Dedilər: "Yəhudilərin içində ondan alimi yoxdur". Buyurdu ki, o bizim aramızda hakim olsun. Abdullah gəldi, Hz. Peyğəmbər buyurdu: "Səni and verirəm yeganə olan və Musadan ötrü dənizi yaran Allah-Təalaya, Tövratda evlilərin zina cəzası rəcmdir, yoxsa yox?" Abdullah dedi: "Bəli, rəcmdir". Yəhudilər qalmaqal salıb onu söydülər. Abdullah dedi: "Mən qorxdum ki, yalan desəm, Allahın kəlamını inkar etsəm, bizə əzab nazil olar". Ondan sonra Hz. Peyğəmbərin əmri ilə məscidin qapısında zinakarları daşqalaq etdilər. Əvvəlki ayə və bundan sonra gələn bir neçə ayə bu əhvalata işarədir).

**42) (سَمَّاعُونَ لِلْكَذِبِ أَكَّالُونَ لِلسُّحْتِ) - bu yəhudilərin alimləri yalana qulaq asıb, haram yeyəndirlər** (rüşvət alıb yalana qulaq asarlar). **(فَإِنْ جَاءُوكَ فَاحْكُمْ بَيْنَهُمْ أَوْ أَعْرِضْ عَنْهُمْ) -** (ey Məhəmməd)**, əgər yəhudilər sənin yanına bir hökmdən ötrü gəlsələr, istəyirsən, onların arasında hökm et, istəyirsən, onlardan üz döndərib sözlərinə qulaq asma, (وَإِنْ تُعْرِضْ عَنْهُمْ فَلَنْ يَضُرُّوكَ شَيْئًا) - əgər onlardan üz döndərib onların arasında hökm etməsən də, əlbəttə, onlar sənə heç bir zərər yetirə bilməzlər. (وَإِنْ حَكَمْتَ فَاحْكُمْ بَيْنَهُمْ بِالْقِسْطِ) - amma əgər onların arasında hökm etsən, ədalətlə hökm et** (Necə ki rəcmdə etdin). **(إِنَّ اللَّهَ يُحِبُّ الْمُقْسِطِينَ) - həqiqətən, Allah-Təala ədalətlə hökm edənləri sevər.**

وَكَيْفَ يُحَكِّمُونَكَ وَعِنْدَهُمُ التَّوْرَاةُ فِيهَا حُكْمُ اللَّهِ ثُمَّ يَتَوَلَّوْنَ مِنْ بَعْدِ ذَلِكَ وَمَا أُولَئِكَ بِالْمُؤْمِنِينَ
﴿٤٣﴾ إِنَّا أَنْزَلْنَا التَّوْرَاةَ فِيهَا هُدًى وَنُورٌ يَحْكُمُ بِهَا النَّبِيُّونَ الَّذِينَ أَسْلَمُوا لِلَّذِينَ هَادُوا وَالرَّبَّانِيُّونَ
وَالْأَحْبَارُ بِمَا اسْتُحْفِظُوا مِنْ كِتَابِ اللَّهِ وَكَانُوا عَلَيْهِ شُهَدَاءَ فَلَا تَخْشَوُا النَّاسَ وَاخْشَوْنِ وَلَا تَشْتَرُوا
بِآيَاتِي ثَمَنًا قَلِيلًا وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ اللَّهُ

---

**43) (وَكَيْفَ يُحَكِّمُونَكَ وَعِنْدَهُمُ التَّوْرَاةُ فِيهَا حُكْمُ اللَّهِ)** – (ey Məhəmməd)**, bu yəhudilər yanında Tövrat ola-ola, səni necə hakim təyin edərlər? (Bir halda ki, sənə və kitabına iman gətirməyiblər). O Tövratda Allah-Təalanın hökmü qeyd olunubdur** (ki, evlilərin zina cəzası rəcmdir, əgər Allah-Təalanın kitabına əməl edən olsalar, Tövrata əməl edərlər. Sənin yanına gəlməkdə məqsədləri hökmü dəyişdirməkdir). **(ثُمَّ يَتَوَلَّوْنَ مِنْ بَعْدِ ذَلِكَ) – sənin yanına gəlib, sən onların barəsində Tövrata müvafiq hökm verəndən sonra üz döndərib sənin hökmünə qulaq asmazlar. (وَمَا أُولَئِكَ بِالْمُؤْمِنِينَ) – bu yəhudilər Tövrata iman gətirən deyillər, əgər Tövrata imanları olsa, sənin Tövrata müvafiq olan sözünə itaət edərlər.**

**44) (إِنَّا أَنْزَلْنَا التَّوْرَاةَ فِيهَا هُدًى وَنُورٌ) – biz Tövratı nazil etdik, onda haqq və ədalətə hidayət etmək və iman nuru vardır. (يَحْكُمُ بِهَا النَّبِيُّونَ الَّذِينَ أَسْلَمُوا) – Allah-Təalaya itaət edən peyğəmbərlər o Tövratla hökm edərlər.** (Peyğəmbərlər hamısı Allah-Təalaya itaət edən olublar, bu kəlamla bütün peyğəmbərlərin xüsusiyyəti bəyan olunur). **(لِلَّذِينَ هَادُوا) – peyğəmbərlər hidayət tapan, küfr və zəlalətdən tövbə edib, Tövratın ehkamına itaət edən şəxslərdən ötrü Tövratla hökm edərlər. (وَالرَّبَّانِيُّونَ وَالْأَحْبَارُ بِمَا اسْتُحْفِظُوا مِنْ كِتَابِ اللَّهِ) – yenə o Tövratla zahidlər və alimlər hökm edərlər, çünki peyğəmbərlər onlara Tövratın ehkamını mühafizə edib saxlamağı vəsiyyət edib. (وَكَانُوا عَلَيْهِ شُهَدَاءَ) – bir də o səbəbə görə hökm edərlər ki, Tövratın hökmlərini gözləyib, dəyişdirilən zaman buna şahid olsunlar. (فَلَا تَخْشَوُا النَّاسَ وَاخْشَوْنِ)** – (ey mənim kitabımla hökm edənlər)**, xalqdan qorxmayın, məndən qorxun, mənim itaətimdən çıxmayın. (وَلَا تَشْتَرُوا بِآيَاتِي ثَمَنًا قَلِيلًا) – mənim ayələrimi və ehkamımı dəyişdirib, az olan məbləğə əvəz onları satmayın.** (Allah-Təala hökmünün müqabilində dünya malı nə qədər çox alınsa da, Allah-Təalanın yanında azdır. Yəhudilərin üləması rüşvət alıb Tövratın ehkamını dəyişdirdiyi kimi, siz müsəlmanlar da yəhudilər kimi olub Quranın ehkamını dəyişdirməyin. (İlahi, özün agahsan ki, sənin Quranda heç bir hökmün yoxdur ki, onu dəyişdirməsinlər. Tövratdan artıq Quranı dəyişdiriblər. Quranı dəyişdirmək müsəlmanların zəifləməsinə və islam dininin ayaqlar altına düşməsinə səbəb olub. İlahi, Quranın hökmünü olduğu kimi deyənlər, bu zamanda xalqın arasında kafir, zındıq kimi sayılır. Ey yardım istəyənlərə yardımçı olan Allah, sən özün bizə kömək ol). **(وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ اللَّهُ) – kim Allah-Təalanın nazil edib göndərdiyi hökmlə hökm**

فَأُولَئِكَ هُمُ الْكَافِرُونَ ﴿٤٤﴾ وَكَتَبْنَا عَلَيْهِمْ فِيهَا أَنَّ النَّفْسَ بِالنَّفْسِ وَالْعَيْنَ بِالْعَيْنِ وَالْأَنْفَ بِالْأَنْفِ
وَالْأُذُنَ بِالْأُذُنِ وَالسِّنَّ بِالسِّنِّ وَالْجُرُوحَ قِصَاصٌ فَمَنْ تَصَدَّقَ بِهِ فَهُوَ كَفَّارَةٌ لَهُ وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ
اللَّهُ فَأُولَئِكَ هُمُ الظَّالِمُونَ ﴿٤٥﴾ وَقَفَّيْنَا عَلَى آثَارِهِمْ بِعِيسَى ابْنِ مَرْيَمَ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ مِنَ التَّوْرَاةِ
وَآتَيْنَاهُ الْإِنْجِيلَ فِيهِ هُدًى وَنُورٌ وَمُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ مِنَ التَّوْرَاةِ وَهُدًى وَمَوْعِظَةً لِلْمُتَّقِينَ ﴿٤٦﴾
وَلْيَحْكُمْ أَهْلُ الْإِنْجِيلِ بِمَا أَنْزَلَ اللَّهُ فِيهِ وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ اللَّهُ فَأُولَئِكَ هُمُ الْفَاسِقُونَ ﴿٤٧﴾

---

**etməsə, (فَأُولَئِكَ هُمُ الْكَافِرُونَ) – əlbəttə, onlar kafirdirlər,** (Tövrat, İncil və Quranın hökmünə əməl etməyənlərin hökmü budur).

**45) (وَكَتَبْنَا عَلَيْهِمْ فِيهَا أَنَّ النَّفْسَ بِالنَّفْسِ) – Tövratda bəni-İsrailə yazıb hökm etdik ki, əgər bir şəxs, başqa bir şəxsi qətlə yetirsə, qatilin canına əvəz öldürülənin canıdır. (Onun əvəzinə gərək öldürülsün. Daha diyət almaq caiz deyildir). (وَالْعَيْنَ بِالْعَيْنِ) – gözün müqabilində, gərək, göz çıxarılsın, (وَالْأَنْفَ بِالْأَنْفِ) – burun əvəzinə, gərək, burun kəsilsin, (وَالْأُذُنَ بِالْأُذُنِ) – qulaq əvəzinə, gərək, qulaq kəsilsin, (وَالسِّنَّ بِالسِّنِّ) – diş əvəzinə, gərək, diş çıxarılsın, (وَالْجُرُوحَ قِصَاصٌ) – yaraların əvəzinə, gərək, qisas olsun.** (Bir şəxs başqa bir şəxsi yaralasa, o da gərək onun əvəzinə onu yaralasın). (Tövratda bu hökmlər olduğu kimi, islam şəriətində də belədir, lakin islam şəriətində şəxs qisas almaqla diyət almaq arasında azaddır. Amma Tövratda diyət almaq yoxdur). **(فَمَنْ تَصَدَّقَ بِهِ) – kim qisas haqqını bağışlayıb qisasdan vaz keçsə, (فَهُوَ كَفَّارَةٌ لَهُ) – o bağışlamaq onun günahlarından ötrü kəffarədir.** (Onun əvəzində Allah-Təala o şəxsin günahını bağışlayar). **(وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ اللَّهُ فَأُولَئِكَ هُمُ الظَّالِمُونَ) – kim Allah-Təalanın göndərdiyi hökmlə hökm etməzsə, əlbəttə, onlar zalımdırlar.**

**46) (وَقَفَّيْنَا عَلَى آثَارِهِمْ بِعِيسَى ابْنِ مَرْيَمَ) – keçən peyğəmbərlərin arxasınca İsa Məryəm oğlunu göndərdik. (مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ مِنَ التَّوْرَاةِ) – özündən qabaq nazil olan Tövratı təsdiq edən idi. (وَآتَيْنَاهُ الْإِنْجِيلَ فِيهِ هُدًى وَنُورٌ) – İsaya İncil kitabını verdik. Onda haqq tərəfinə hidayət edib iman nuruyla nurlandırmaq var. (وَمُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ مِنَ التَّوْرَاةِ) – özündən əvvəlki Tövratı təsdiq edəndir.** (İncildə Tövratın haqq olması qeyd olunub). **(وَهُدًى وَمَوْعِظَةً لِلْمُتَّقِينَ) – İncil müttəqi şəxslərdən ötrü hidayət və öyüd-nəsihətdir.** (İncilin sözləri gözəl öyüd-nəsihətlərdir. Əlbəttə, İsa kimi şəxsin öyüd-nəsihəti kimi söz olmaz, heyif! Hanı eşidən qulaq, hanı inanan qəlb? Xalq dünyaya o qədər hərisdir ki, nə Tövrat, nə İncil, nə Quran, heç biri yada düşmür).

**47) (وَلْيَحْكُمْ أَهْلُ الْإِنْجِيلِ بِمَا أَنْزَلَ اللَّهُ فِيهِ) – əlbəttə, İncil əhli Allah-Təalanın İncildə nazil etdiyi hökmlərlə, gərək, hökm etsinlər. (وَمَنْ لَمْ يَحْكُمْ بِمَا أَنْزَلَ اللَّهُ فَأُولَئِكَ هُمُ الْفَاسِقُونَ) – kim Allah-Təalanın göndərdiyi hökmlə hökm etməsə, əlbəttə, onlar fasiqdirlər.** (Bu 3 ayədə Allah-Təala öz hökmüylə hökm etməyən şəxsləri

**وَأَنْزَلْنَا إِلَيْكَ الْكِتَابَ بِالْحَقِّ مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ مِنَ الْكِتَابِ وَمُهَيْمِنًا عَلَيْهِ فَاحْكُمْ بَيْنَهُمْ بِمَا أَنْزَلَ اللَّهُ وَلَا تَتَّبِعْ أَهْوَاءَهُمْ عَمَّا جَاءَكَ مِنَ الْحَقِّ لِكُلٍّ جَعَلْنَا مِنْكُمْ شِرْعَةً وَمِنْهَاجًا وَلَوْ شَاءَ اللَّهُ لَجَعَلَكُمْ أُمَّةً وَاحِدَةً وَلَكِنْ لِيَبْلُوَكُمْ فِي مَا آتَاكُمْ فَاسْتَبِقُوا الْخَيْرَاتِ إِلَى اللَّهِ مَرْجِعُكُمْ جَمِيعًا فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ ﴿٤٨﴾ وَأَنِ احْكُمْ بَيْنَهُمْ بِمَا أَنْزَلَ اللَّهُ وَلَا تَتَّبِعْ أَهْوَاءَهُمْ وَاحْذَرْهُمْ أَنْ يَفْتِنُوكَ عَنْ بَعْضِ مَا أَنْزَلَ اللَّهُ إِلَيْكَ**

---

3 pis xüsusiyyətlə yad edir: biri kafir, digəri zalım, o birisi də fasiqdir, üçündə də həmin kafirlik nəzərdə tutulub, hansı ki küfrdə son dərəcə inadkar və təkəbbürlü olub zülm və fasiqlik xüsusiyyətlərini özünə şüar edib, Allah-Təalanın ayə və ehkamlarına əməl etməzlər. Əgər bu zamanda bütün dünyanı axtarsan, nə yəhudi, nə xristian nə də müsəlmanlardan bir şəxs tapa bilməzsən ki, öz kitabının hökmünə tabe olub ona dürüst əməl etsin. Vay olsun biz məxluqatın halına, adımızı əhli-kitab qoyub, amma kitabın ehkamından birdəfəlik uzaqlaşmışıq).

**48) (وَأَنْزَلْنَا إِلَيْكَ الْكِتَابَ بِالْحَقِّ)** – (ey Məhəmməd)**, İsadan sonra bu Quranı haqq olaraq sənə nazil etdik. (مُصَدِّقًا لِمَا بَيْنَ يَدَيْهِ مِنَ الْكِتَابِ) – bu Quran özündən əvvəlki kitabları** (İncil, Tövratı) **təsdiq edəndir. (وَمُهَيْمِنًا عَلَيْهِ) – əvvəlki kitabların hamısının Allah-Təala tərəfindən səhih və dürüst olmasına şahidlik edəndir. (فَاحْكُمْ بَيْنَهُمْ بِمَا أَنْزَلَ اللَّهُ)** – (ey Məhəmməd)**, xalqın arasında Allah-Təalanın sənə bu Quranda göndərdiyi hökmlə hökm et. (وَلَا تَتَّبِعْ أَهْوَاءَهُمْ عَمَّا جَاءَكَ مِنَ الْحَقِّ) – xalqın nəfsani istəklərinə tabe olub, Allah-Təaladan gələn sözlərdən üz döndərib vaz keçmə. (لِكُلٍّ جَعَلْنَا مِنْكُمْ شِرْعَةً وَمِنْهَاجًا) – siz yəhudilər, xristianlar və müsəlmanların hər birindən ötrü bir şəriət və bir yol təyin etmişəm ki, o yolla gedəsiniz.** (Əsl din birdir, lakin qanun və hökmlər müxtəlifdir. Bundan əvvəl, gərək, Tövrat və İncilin hökmünə tabe olaydınız. İndi isə gərək, Qurana tabe olasınız). **(وَلَوْ شَاءَ اللَّهُ لَجَعَلَكُمْ أُمَّةً وَاحِدَةً) – əgər Allah-Təala istəsə idi, sizə bir şəriət göndərib sizi bir ümmət və bir camaat edərdi. (وَلَكِنْ لِيَبْلُوَكُمْ فِي مَا آتَاكُمْ) – lakin Allah-Təala sizə müxtəlif şəriətlər verməklə sizi imtahan edir, görsün ki, şəriətlərin hamısına əməl edib təsdiq edirsiniz, yoxsa yox. (فَاسْتَبِقُوا الْخَيْرَاتِ) – ilahi ehkama əməl etməkdə bir-birinizdən əvvəldə olmağa çalışın. (إِلَى اللَّهِ مَرْجِعُكُمْ جَمِيعًا) – itaətdə olan və ya asi olanların, hamınızın qayıdacağınız yer Allah-Təalanın tərəfinədir. (فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ) – o hökmlər ki, dünyada onlarda ixtilaf edirdiniz, Allah-Təala o hökmləri sizə qiyamət günündə xəbər verib hər şəxsin əməlinin qarşılığını ona verəcəkdir.**

**49) (وَأَنِ احْكُمْ بَيْنَهُمْ بِمَا أَنْزَلَ اللَّهُ)** – (ey Məhəmməd)**, əlbəttə, xalqın arasında Allah-Təalanın Quranda nazil etdiyi hökmlə hökm et. (وَلَا تَتَّبِعْ أَهْوَاءَهُمْ) – xalqın nəfsani arzularına tabe olma. (وَاحْذَرْهُمْ أَنْ يَفْتِنُوكَ عَنْ بَعْضِ مَا أَنْزَلَ اللَّهُ إِلَيْكَ) – xalqın səni Allah-Təalanın göndərdiyi hökmlərin bəzisindən kənara salıb**

فَإِنْ تَوَلَّوْا فَاعْلَمْ أَنَّمَا يُرِيدُ اللهُ أَنْ يُصِيبَهُمْ بِبَعْضِ ذُنُوبِهِمْ وَإِنَّ كَثِيرًا مِنَ النَّاسِ لَفَاسِقُونَ ﴿٤٩﴾
أَفَحُكْمَ الْجَاهِلِيَّةِ يَبْغُونَ وَمَنْ أَحْسَنُ مِنَ اللهِ حُكْمًا لِقَوْمٍ يُوقِنُونَ ﴿٥٠﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا
تَتَّخِذُوا الْيَهُودَ وَالنَّصَارَى أَوْلِيَاءَ بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ وَمَنْ يَتَوَلَّهُمْ مِنْكُمْ فَإِنَّهُ مِنْهُمْ إِنَّ اللهَ لَا يَهْدِي
الْقَوْمَ الظَّالِمِينَ ﴿٥١﴾

---

**onun xilafına hökm etdirməsindən qorx (yəhudilərin böyüklərindən bir qrup adam Hz. Peyğəmbərin hüzuruna gəlib dedilər: "Ey peyğəmbər, bizim özgə şəxslərlə mübahisəmiz var, sənin hüzuruna məhkəməyə gələndə əgər bizim xeyrimizə hökm etsən, o vaxt sənə iman gətirərik. Biz sənə iman gətirsək, bütün yəhudilər iman gətirərlər".** (Hərçənd Hz. Peyğəmbər tərəfgirlik edib hökm verən deyildi. Lakin bu hökmü islam ümməti üçün əbədi etməkdən ötrü bu ayə nazil oldu). **(فَإِنْ تَوَلَّوْا)** – (ey Məhəmməd)**, sən Allah-Təalanın hökmüylə hökm et, əgər Allah-Təalanın hökmünə razı olmayıb üz döndərsələr, (فَاعْلَمْ أَنَّمَا يُرِيدُ اللهُ أَنْ يُصِيبَهُمْ بِبَعْضِ ذُنُوبِهِمْ)** – (ey Məhəmməd)**, o vaxt bil ki, Allah-Təalanın onların haqqında istəyi odur ki, dünyada bu günahları səbəbi ilə onlara əzab yetirsin.** (Allah-Təalanın əzabı reallaşıb, müsəlmanları yəhudilərə hakim edib hamısı zəlil oldular). **(وَإِنَّ كَثِيرًا مِنَ النَّاسِ لَفَاسِقُونَ)** – **həqiqətən, xalqın əksəriyyəti küfrlərində inadkar olub Allah-Təalanın hökmünə itaət edən deyillər.**

**50) (أَفَحُكْمَ الْجَاهِلِيَّةِ يَبْغُونَ)** – (ey Məhəmməd)**, bəs səndən cahiliyyə hökmünü istəyirlər ki, onların istəyinə görə aralarında hökm edəsən? Cahiliyyə zamanı keçdi. İndi islami dövrdür. Din haqqında belə hökmlər olmaz. (وَمَنْ أَحْسَنُ مِنَ اللهِ حُكْمًا لِقَوْمٍ يُوقِنُونَ)) – tam bilikli olan camaatdan ötrü Allah-Təaladan yaxşı və gözəl hökm edən kimdir? Hansı ki onlar inanıblar ki, Allah-Təaladan yaxşı və gözəl hökm edən olmaz.**

**51) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا)** – **ey iman gətirən şəxslər, (لَا تَتَّخِذُوا الْيَهُودَ وَالنَّصَارَى أَوْلِيَاءَ)** – (bu ayə Uhud savaşında bəzi müsəlmanların haqqında nazil oldu, elə ki Uhud savaşında Hz. Peyğəmbərin qoşunu məğlub oldu, imanlarında sabit olmayan bəzi müsəlmanlar dedilər: "Gedək yəhudilərə pənah aparaq," bəzisi də belə dedi: "Şama gedib xristianlara pənah aparaq," - ayədə onlara xitab edib buyurur: "Ey möminlər, siz özünüzdən ötrü yəhudi və xristianları dost tutmayın. Bu məqamda onlar sizə kömək olmazlar. Müşriklərə kömək olarlar). **(بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ)** – **onlar bir-birilərinə dost olub sizə düşməndirlər. (وَمَنْ يَتَوَلَّهُمْ مِنْكُمْ فَإِنَّهُ مِنْهُمْ)** – **sizdən kim ki peyğəmbəri qoyub, onların tərəfinə gedib onlardan özünə dost seçsə, o şəxs müsəlmanların sırasından kənar olub onlardan hesab olunar. (Əgər müsəlmanlar qalib olsalar, onlara aman yoxdur)". (إِنَّ اللهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ)** – **həqiqətən, Allah-Təala müsəlmanları bu halda qoyub gedib yəhudi və xristianlara qoşulan *zalım camaata hidayət etməz.**

فَتَرَى الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ يُسَارِعُونَ فِيهِمْ يَقُولُونَ نَخْشَى أَنْ تُصِيبَنَا دَائِرَةٌ فَعَسَى اللَّهُ أَنْ يَأْتِيَ بِالْفَتْحِ أَوْ أَمْرٍ مِنْ عِنْدِهِ فَيُصْبِحُوا عَلَى مَا أَسَرُّوا فِي أَنْفُسِهِمْ نَادِمِينَ ﴿٥٢﴾ وَيَقُولُ الَّذِينَ آمَنُوا أَهَؤُلَاءِ الَّذِينَ أَقْسَمُوا بِاللَّهِ جَهْدَ أَيْمَانِهِمْ إِنَّهُمْ لَمَعَكُمْ حَبِطَتْ أَعْمَالُهُمْ فَأَصْبَحُوا خَاسِرِينَ ﴿٥٣﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا مَنْ يَرْتَدَّ مِنْكُمْ عَنْ دِينِهِ

---

*(****Qeyd:*** *Bu hökm Hz. Peyğəmbərin dövrünə məxsusdur, yoxsa Allah-Təala Qurani-Şərifdə neçə yerdə əhli-kitabı müsəlmanlara tövsiyə edibdir. Xüsusən, xristianları, necə ki həmin 6-cı cüzün axırında müsəlmanlara xristianları sevməyi bəyan edir: "Yəni siz müsəlmanlar onları sevin". Hz. Peyğəmbərin onların xərac verərək, öz dinlərində qalmalarına izin verməsi müsəlmanların əhli-kitaba yaxınlaşmağı üçün kafidir. Heç vaxt hökm verməyibdir ki, əhli-kitab mütləq müsəlman olmalıdır. Bir də əhli-kitabı qətlə yetirən şəxsin hökmü müsəlmanı qətlə yetirən şəxsin hökmüylə eyni olması Nisa surəsində qeyd olundu, amma insaflı şəxslər bilir ki, bu məqamda bu ayənin hökmü, gərək, belə olsun, necə ki qeyd olundu).*

**52) (فَتَرَى الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ) -** (ey Məhəmməd)**, qəlblərində nifaq naxoşluğu olan o şəxsləri görürsən, (يُسَارِعُونَ فِيهِمْ) – hansı ki yəhudilərlə dostluğa can atırlar, (يَقُولُونَ نَخْشَى أَنْ تُصِيبَنَا دَائِرَةٌ)** – (əgər onlara desən ki, niyə yəhudilərə məhəbbət bəsləyib onlarla dostluq edirsiniz?) **Belə deyərlər: "Müsibət zamanı bizə bir müsibət üz verməsindən qorxuruq** (ki, o zaman yəhudilər bizə kömək etməz)". (Hz. Məhəmmədin işi düzəlməyib qoşunu məğlub olub, tərəfdarları dağıldı). **(فَعَسَى اللَّهُ أَنْ يَأْتِيَ بِالْفَتْحِ أَوْ أَمْرٍ مِنْ عِنْدِهِ)** – (ey möminlər)**, ümidvar olun, əlbəttə, Allah-Təala sizə bir fəth və qələbə bəxş edib islamı yayar, ya da bir tədbir görüb, yəhudiləri zəlil edib öz vilayətlərindən çıxarar.** (Allah-Təalanın bu vədi doğru oldu, müsəlmanlar qalib olub yəhudiləri Mədinədən çıxartdılar). **(فَيُصْبِحُوا عَلَى مَا أَسَرُّوا فِي أَنْفُسِهِمْ نَادِمِينَ) – o vaxt da münafiqlər içlərində gizlətdikləri sözlərdən peşman olarlar.** (Münafiqlər həmişə düşünürdülər ki, birdən Məhəmmədin işi düzəlməz, biz bu yəhudilərlə dostluq edək, nə vaxtsa bizə lazım olarlar).

**53) (وَيَقُولُ الَّذِينَ آمَنُوا) – nə zaman ki münafiqlərin nifaqı zahir oldu, onların haqqında möminlər bir-birilərinə dedilər: (أَهَؤُلَاءِ الَّذِينَ أَقْسَمُوا بِاللَّهِ جَهْدَ أَيْمَانِهِمْ إِنَّهُمْ لَمَعَكُمْ) – bəs bu münafiqlər o şəxslərdir ki, Allah-Təalaya möhkəm and içib deyirdilər ki, siz müsəlmanlara köməkçidirlər? İndi nifaqları zahir oldu. (حَبِطَتْ أَعْمَالُهُمْ) – nə ki əməl etmişdilər, əməlləri tamam batil oldu. (فَأَصْبَحُوا خَاسِرِينَ) –dönüb dünya və axirətdə özlərinə ziyankar oldular.**

**54)(يَا أَيُّهَا الَّذِينَ آمَنُوا مَنْ يَرْتَدَّ مِنْكُمْ عَنْ دِينِهِ) – ey iman gətirən şəxslər, sizlərdən* kim mürtəd olub öz dinindən dönsə, Allah-Təalaya heç bir zərər yetirməz.**

فَسَوْفَ يَأْتِي اللّهُ بِقَوْمٍ يُحِبُّهُمْ وَيُحِبُّونَهُ أَذِلَّةٍ عَلَى الْمُؤْمِنِينَ أَعِزَّةٍ عَلَى الْكَافِرِينَ

---

*(***Qeyd:** 11 tayfa islamdan çıxıb mürtəd olmuşdu. Onlardan 3 tayfa Hz. Peyğəmbərin zamanında olub. Birincisi - Yəməndə bəni-Müdlic tayfası idi ki, onların rəisi Zülxumar Əsvəd əl-Ansi idi, peyğəmbərlik iddiası edib Yəmən məmləkətini ələ keçirib, Hz. Peyğəmbərin vergi məmurlarını oradan qovdu. Hz. Peyğəmbər Yəmən hakimi Muaz ibn Cəbələ və ondan başqa digər Yəmən əyanlarına məktub yazıb Əsvədi məğlub etmək üçün onları vəzifələndirdi. Feyruz Deyləmi Əsvədi qətlə yetirib tərəfdarlarını dağıtdı. 2-ci tayfa Yəməndəki bəni-Hənifə tayfası olub rəisləri Müseyləmə peyğəmbərlik iddiası edib, böyük bir camaat ona tabe oldu. Hz. Peyğəmbərdən sonra Əbu Bəkir onun üstünə qoşun göndərib, Vəhşi (Həmzənin qatili) də Müseyləməni qətlə yetirdi, camaatı da dağıldı. 3-cü tayfa Bəsrə ətrafındakı Bəni-Əsəd camaatı idi, rəisləri Tüleyha ibn Xüveylid peyğəmbərlik iddiası edib, Hz. Peyğəmbər Xalid ibn Vəlid Seyfullahı (Allahın qılıncı) onunla savaşa göndərib, Xalid onun qoşununu dağıdıb özü qaçıb Şama getdi. Ondan sonra müsəlman olub islamda sabit və bərqərar oldu. 7 tayfa Əbu Bəkir zamanında mürtəd oldu. 1-Firazə tayfası, rəisləri Übeyd ibn Həsən idi, 2-Qətafan tayfası, rəisləri Qürrə ibn Səlma idi, 3- Bəni-Süleym tayfası, rəisləri Fəca ibn Əbdiyaleyl idi, 4-Bəni-Yərbu tayfası, rəisləri Malik ibn Nüveyrə idi, 5-Bəni-Təmimdən bir camaat, rəisləri Səcah Munzir qızı idi, peyğəmbərlik iddiası etmişdi. 6- Yəməndəki Kində qəbiləsi, rəisləri Əş`as ibn Qeys idi, 7-Bəhreyndə Bəni-Bəkir ibn Vail tayfası, rəisləri Hatəm ibn Zeyd idi. Bu tayfaları Allah-Təala Əbu Bəkrin sayəsində məğlub edib xilafəti zamanında hamısını dəf etdi, bir tayfa - Şamda Qəssan qəbiləsi Ömərin zamanında mürtəd oldu, rəisləri Cəbələ ibn Eyhəm idi. Ömərin tədbirləri sayəsində onların da şəri islamdan dəf olundu).*

**(فَسَوْفَ يَأْتِي اللّهُ بِقَوْمٍ يُحِبُّهُمْ وَيُحِبُّونَهُ) – əlbəttə, Allah-Təala tezliklə onlardan sonra iman əhli bir camaat gətirər, Allah-Təala onları sevər, (yəni onlara gözəl şəkildə mükafat verib, onlardan razı olar), onlar da Allah-Təalanı sevərlər,** (yəni Allah-Təalaya itaət edib Haqq-Təalanın qəzəbinə bais olan əməllərdən çəkinərlər. Allah-Təalanın xəbər verdiyi bu camaat Hz. Peyğəmbərdən sonra cihad edib dünyanın əksər yerlərini islama daxil edib islamı yayanlardır). **(أَذِلَّةٍ عَلَى الْمُؤْمِنِينَ أَعِزَّةٍ عَلَى الْكَافِرِينَ)** – (Allah-Təalanın sevdiyi camaatın xüsusiyyəti budur ki), **möminlərə qarşı* mülayim və təvazökar olarlar, amma kafirlərə qarşı son dərəcə sərt və qüvvətli olub** (şücaətdə şir kimi olarlar. Bu xüsusiyyətdə olan kiçik bir camaat sayca çox olan camaata qalib oldu).

*(***Qeyd:** Haqq-Təalanın Qurani-Şərifində vəsf etdiyi gözəl əməllərə və gözəl vəsflərə sahib olan din və millət qardaşlarımız bir-birilərinə mülayimlik və təvazökarlıq izhar edib, bir-birilərini öz canı və ruhu kimi bilib, ittihad və ittifaqa rəğbət və həvəs etməklə islam dininə rövnəq və rəvac verib yer üzünü islamın nuruyla nurlandırdılar. Afrikadan Çinə qədər islamın pak və parlaq olan mübarək nuru işıq saçırdı. Əfsus keçən günlərimizə, keçən sədaqət və ittihad dövrümüzə, Allah-Təalanın Qurani-Şərifində vəsf etdiyi dindar və təvazökar əcdadlarımıza, hanı indi o şəxslər və o şəxslərdə olan gözəl xüsusiyyətlər, dindarlıq, millətpərəstlik, sədaqət, ittihad,*

يُجَاهِدُونَ فِي سَبِيلِ اللَّهِ وَلَا يَخَافُونَ لَوْمَةَ لَائِمٍ ذَلِكَ فَضْلُ اللَّهِ يُؤْتِيهِ مَنْ يَشَاءُ وَاللَّهُ وَاسِعٌ عَلِيمٌ
﴿٥٤﴾ إِنَّمَا وَلِيُّكُمُ اللَّهُ وَرَسُولُهُ وَالَّذِينَ آمَنُوا الَّذِينَ يُقِيمُونَ الصَّلَاةَ وَيُؤْتُونَ الزَّكَاةَ وَهُمْ رَاكِعُونَ ﴿٥٥﴾
وَمَنْ يَتَوَلَّ اللَّهَ وَرَسُولَهُ وَالَّذِينَ آمَنُوا فَإِنَّ حِزْبَ اللَّهِ هُمُ الْغَالِبُونَ ﴿٥٦﴾

---

*ittifaq və qeyrət, indi onun əksidir. İndi adını müsəlman qoyan kişilərimiz öz din və millətindən olan bir müsəlman qardaşını gördükdə təkəbbür və qürurundan ondan üz döndərib, nifaq və inadkarlıq edib bir-birilərinin qətlinə, zillətinə, pisliyinə çalışırlar, vay olsun belə müsəlman şəxslərə, bunlara müsəlman deyilərmi? Bəlkə, münafiq demək daha doğrudur).*

**(يُجَاهِدُونَ فِي سَبِيلِ اللَّهِ) – Allah-Təala yolunda cihad edib islam dininə rəvac verib, (وَلَا يَخَافُونَ لَوْمَةَ لَائِمٍ) – heç bir məzəmmət edənin məzəmmətindən qorxmazlar. (Allah-Təalanın sevdiyi şəxslərin xüsusiyyətlərindən biri də budur.** (Bəli, islamın ilk dövründə dinə rəvac verən müsəlmanlar belə şəxslər idi, indi onlar kimi bir nəfər də tapılmaz. İslam ümmətinin hələ də yaşaması onların bərəkətindəndir). **(ذَلِكَ فَضْلُ اللَّهِ يُؤْتِيهِ مَنْ يَشَاءُ) – bu xüsusiyyətlər** (möminlərə qarşı təvazökar olub, kafirlərə qarşı sərt olmaq və cihad edib, məzəmmət edənin məzəmmətindən qorxmamaq) **ki, qeyd olundu, Allah-Təalanın lütf və mərhəmətidir. İstədiyi şəxsə bəxş edər. (وَاللَّهُ وَاسِعٌ عَلِيمٌ) – Allah-Təalanın lütf və mərhəməti genişdir, kim bu gözəl xüsusiyyətlərə layiqdirsə, ona bəxş etməyə agahdır.**

**55) (إِنَّمَا وَلِيُّكُمُ اللَّهُ وَرَسُولُهُ وَالَّذِينَ آمَنُوا)** – (əvvəlki ayədə kafirləri dost tutmağı qadağan etdi. Bu ayədə qeyd olunan şəxsləri dost tutmağı əmr edir). **Həqiqətən, sizin dostlarınız və o şəxslər ki gərək onları dost tutasınız, Allah-Təalanın peyğəmbəri** (Hz. Məhəmməd) **və bir də onlara iman gətirən şəxslərdir. (الَّذِينَ يُقِيمُونَ الصَّلَاةَ وَيُؤْتُونَ الزَّكَاةَ وَهُمْ رَاكِعُونَ) – möminlərin xüsusiyyətləri odur ki, namaz qılıb namazda rükuda olduqları halda fəqirlərə sədəqə verərlər,** (bu ayə əmirəl-möminin Hz. Əli (ə.s), haqqında nazil olubdur. O həzrət məsciddə namazda rüku halətində idi, dilənçi ondan sədəqə istədi, o həzrət barmağından üzüyünü çıxarıb dilənçiyə verdi. Təfsirçilərdən Zəməxşəri "Kəşşaf"da, Fazil Nəsəfi "Mədariküt-tənzil"də, Fazil Əlauddin Xazin Sufi "Lübabüt-təvil"də qeyd ediblər ki, bu ayə Hz. Əli haqqında varid olubdur. Şeyx Süleyman Bəlxi "Yənabiül-məvəddə"də bu barədə bir çox hədis qeyd edibdir).

**56) (وَمَنْ يَتَوَلَّ اللَّهَ وَرَسُولَهُ وَالَّذِينَ آمَنُوا) – kim Allah-Təalanı, onun peyğəmbərini və iman gətirən şəxsləri dost tutsa, həqiqətən, onlar Allah-Təalanın köməkçiləri və camaatıdır. (فَإِنَّ حِزْبَ اللَّهِ هُمُ الْغَالِبُونَ) – həqiqətən, Allah-Təalanın camaatı kafir və müşriklərə qalib olandır.**

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَتَّخِذُوا الَّذِينَ اتَّخَذُوا دِينَكُمْ هُزُوًا وَلَعِبًا مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ
وَالْكُفَّارَ أَوْلِيَاءَ وَاتَّقُوا اللَّهَ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿٥٧﴾ وَإِذَا نَادَيْتُمْ إِلَى الصَّلَاةِ اتَّخَذُوهَا هُزُوًا وَلَعِبًا
ذَلِكَ بِأَنَّهُمْ قَوْمٌ لَا يَعْقِلُونَ ﴿٥٨﴾ قُلْ يَا أَهْلَ الْكِتَابِ هَلْ تَنْقِمُونَ مِنَّا إِلَّا أَنْ آمَنَّا بِاللَّهِ وَمَا أُنْزِلَ
إِلَيْنَا وَمَا أُنْزِلَ مِنْ قَبْلُ وَأَنَّ أَكْثَرَكُمْ فَاسِقُونَ ﴿٥٩﴾ قُلْ هَلْ أُنَبِّئُكُمْ بِشَرٍّ مِنْ ذَلِكَ مَثُوبَةً عِنْدَ اللَّهِ مَنْ
لَعَنَهُ اللَّهُ وَغَضِبَ عَلَيْهِ وَجَعَلَ مِنْهُمُ الْقِرَدَةَ وَالْخَنَازِيرَ وَعَبَدَ الطَّاغُوتَ أُولَئِكَ شَرٌّ مَكَانًا

---

**57) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirən şəxslər, (لَا تَتَّخِذُوا الَّذِينَ اتَّخَذُوا دِينَكُمْ هُزُوًا وَلَعِبًا مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِكُمْ وَالْكُفَّارَ أَوْلِيَاءَ) – əhli-kitab və müşriklərdən o şəxslər ki dininizə məsxərə və istehza edirlər, onları özünüzə dost tutmayın. (وَاتَّقُوا اللَّهَ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ) – əgər möminsinizsə, Allah-Təaladan qorxub onun düşmənlərindən kənar olun.**

**58) (وَإِذَا نَادَيْتُمْ إِلَى الصَّلَاةِ اتَّخَذُوهَا هُزُوًا وَلَعِبًا) – nə zaman ki namaz vaxtında azan deyib namaz tərəfinə çağırsanız, əvvəldə qeyd olunan şəxslər namaza istehza edib özlərindən ötrü oyun sayarlar. (ذَلِكَ بِأَنَّهُمْ قَوْمٌ لَا يَعْقِلُونَ) – onların bu istehza etmələri ona görədir ki, ağılsız olub, ağılları ilə rəftar etməzlər. Çünki belə əməllər səfeh və ağılsız şəxslərdən əmələ gələr.** (Yəhudilərdən bir qrup Hz. Peyğəmbərin hüzuruna gəlib dedi: “Sən keçən peyğəmbərlərdən hansı birini təsdiq edirsən?” Hz. Peyğəmbər bütün peyğəmbərləri qeyd etdi, elə ki Hz. İsanın adını çəkdi, yəhudilər dedilər: “Sizin dininizdən pis və batil din yoxdur, çünki siz İsanı peyğəmbər sayırsınız”. O vaxt sıradakı ayə nazil oldu).

**59) (قُلْ يَا أَهْلَ الْكِتَابِ)** – (ey Məhəmməd)**, bu yəhudilərə de ki, ey əhli-kitab, (هَلْ تَنْقِمُونَ مِنَّا إِلَّا أَنْ آمَنَّا بِاللَّهِ وَمَا أُنْزِلَ إِلَيْنَا وَمَا أُنْزِلَ مِنْ قَبْلُ) – bəs bizə eyib tutub dinimizi batil bilirsiniz? Bizdə nə xilaf əməl vardır, heç bir xilaf və pis əməl bizdə yoxdur, ancaq Allah-Təalaya və bizə nazil olan kitaba, bir də bizdən əvvəl nazil olan kitablara - onlardan biri də İncildir, iman gətirmişik. Bəs Allah-Təalanın kitablarına iman gətirdiyimiz üçün bizə eyib tutursunuz? (وَأَنَّ أَكْثَرَكُمْ فَاسِقُونَ) – həqiqətən, siz yəhudilərin çoxu fasiqdir, küfr və zəlalətdə yüksəlmisiniz.**

**60) (قُلْ هَلْ أُنَبِّئُكُمْ بِشَرٍّ مِنْ ذَلِكَ مَثُوبَةً عِنْدَ اللَّهِ)** – (ey Məhəmməd)**, yəhudilərə de ki, siz bizə eyib tutursunuz? Bəs sizə Allah-Təala yanında əməllərinin cəzasına görə bizdən pis olan qövmü xəbər verim? (مَنْ لَعَنَهُ اللَّهُ وَغَضِبَ عَلَيْهِ) – onlar o camaatdır ki, Allah-Təala onları öz rəhmətindən kənar edib onlara qəzəb edibdir. (وَجَعَلَ مِنْهُمُ الْقِرَدَةَ وَالْخَنَازِيرَ وَعَبَدَ الطَّاغُوتَ) – onların o əməllərinə görə, Allah-Təala onları çirkinləşdirib, batini surətlərini meymun və donuz surətinə daxil edib, şeytana ibadət edən edibdir. (أُولَئِكَ شَرٌّ مَكَانًا) – bu qeyd olunan xüsusiyyətlərin sahibi olan camaat**

وَأَضَلُّ عَنْ سَوَاءِ السَّبِيلِ ﴿٦٠﴾ وَإِذَا جَاءُوكُمْ قَالُوا آمَنَّا وَقَدْ دَخَلُوا بِالْكُفْرِ وَهُمْ قَدْ خَرَجُوا بِهِ
وَاللَّهُ أَعْلَمُ بِمَا كَانُوا يَكْتُمُونَ ﴿٦١﴾ وَتَرَى كَثِيرًا مِنْهُمْ يُسَارِعُونَ فِي الْإِثْمِ وَالْعُدْوَانِ وَأَكْلِهِمُ
السُّحْتَ لَبِئْسَ مَا كَانُوا يَعْمَلُونَ ﴿٦٢﴾ لَوْلَا يَنْهَاهُمُ الرَّبَّانِيُّونَ وَالْأَحْبَارُ عَنْ قَوْلِهِمُ الْإِثْمَ وَأَكْلِهِمُ
السُّحْتَ لَبِئْسَ مَا كَانُوا يَصْنَعُونَ ﴿٦٣﴾

---

**pis məxluqdur. (**وَأَضَلُّ عَنْ سَوَاءِ السَّبِيلِ**) – haqq yolundan kənar olub uzaq düşübdürlər.** (Ey yəhudilər, bu xüsusiyyətlər tamamən sizdədir. O pis olan camaat sizsiniz, özünüzdə bu xüsusiyyətlər olan halda necə bizə eyib tuta bilərsiniz?) (Yəhudilərdən bir camaat Hz. Peyğəmbərin hüzuruna daxil olub iman izharı etdilər ki, sənə iman gətirmişik, halbuki yalan deyirdilər. Bu barədə sıradakı ayə nazil oldu).

**61) (**وَإِذَا جَاءُوكُمْ قَالُوا آمَنَّا**)** – (ey Məhəmməd)**, nə zaman ki yəhudilər sənin hüzuruna gəlib dedilər: "Sənə iman gətirmişik,"** (وَقَدْ دَخَلُوا بِالْكُفْرِ وَهُمْ قَدْ خَرَجُوا بِهِ) **– onlarda əsla iman yoxdur, həqiqətən, sənin yanına küfrlə daxil olub yenə küfrlə çıxdılar. Küfrlərində daimidirlər. Yalandan deyirlər ki, biz sənə iman gətirmişik. (**وَاللَّهُ أَعْلَمُ بِمَا كَانُوا يَكْتُمُونَ**) – Allah-Təala onların gizlətdikləri küfrlərinə, küfrü gizlədib iman izharı etmələrinə agahdır.**

**62) (**وَتَرَى كَثِيرًا مِنْهُمْ**)** – (ey Məhəmməd)**, yəhudilərdən çoxusunu görürsən ki, (**يُسَارِعُونَ فِي الْإِثْمِ وَالْعُدْوَانِ وَأَكْلِهِمُ السُّحْتَ**) – yalan deyib zülm edib, haram və rüşvət alıb yeməyə tələsirlər, bu şeyləri elə sürətlə edirlər ki, guya vacib iş görürlər. (**لَبِئْسَ مَا كَانُوا يَعْمَلُونَ**) – yəhudilər nə pis şeylər edirlər.** (Əlbəttə, yalan demək, zülm etmək, haram yeməkdən böyük pis əməl olmaz. Kimdir Quranın nəsihətinə qulaq asan, Quranın nəsihətinə itaət edən?)

**63) (**لَوْلَا يَنْهَاهُمُ الرَّبَّانِيُّونَ وَالْأَحْبَارُ عَنْ قَوْلِهِمُ الْإِثْمَ وَأَكْلِهِمُ السُّحْتَ**) – yəhudilərin alimləri və zahidləri nəyə görə* onlara yalan deməyi və haram yeməyi qadağan etmədilər? Alimin vəzifəsidir ki, gərək, Allahın hökmünü xalqa çatdırıb, onları pis əməllərdən qorusunlar. (**لَبِئْسَ مَا كَانُوا يَصْنَعُونَ**) – yəhudilərin alimləri nə pis, qəbih əməllər edirlər,** (pis əməlləri qadağan etmə əmrini tərk edib, Allah-Təalanın hökmünü yetirmirlər).

*(****Qeyd:*** *Bu ayə islam üləmasının qulağını açmaqdan ötrü bir ox, ya da mismar kimidir ki, qulaqları açılıb, Allah-Təalanın hökmlərini xalqa çatdırsınlar. Tənbəllik və tərəfgirlik etməsinlər. Allah-Təaladan ötrü nəfsani arzularından keçib Allahın hökmünü xalqa çatdırsınlar. Məxluqatın fəsadı üləmadandır. Möhtərəm peyğəmbərimiz buyurubdur: "Nə zaman ki alim fəsad edər, aləm fəsad edər". Bu söz haqq peyğəmbər sözüdür. Üləma gərək öz içindəki ixtilaflara son verib söz və əməllərini Allah-Təaladan ötrü etsin (Buxari, Elm 34; Müslüm, Elm 13; Tirmizi, Elm 5; İbn Macə, Müqəddimə 8)).*

وَقَالَتِ الْيَهُودُ يَدُ اللهِ مَغْلُولَةٌ غُلَّتْ أَيْدِيهِمْ وَلُعِنُوا بِمَا قَالُوا بَلْ يَدَاهُ مَبْسُوطَتَانِ يُنْفِقُ كَيْفَ يَشَاءُ وَلَيَزِيدَنَّ
كَثِيرًا مِنْهُمْ مَا أُنْزِلَ إِلَيْكَ مِنْ رَبِّكَ طُغْيَانًا وَكُفْرًا وَأَلْقَيْنَا بَيْنَهُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاءَ إِلَى يَوْمِ الْقِيَامَةِ كُلَّمَا
أَوْقَدُوا نَارًا لِلْحَرْبِ أَطْفَأَهَا اللهُ وَيَسْعَوْنَ فِي الْأَرْضِ فَسَادًا وَاللهُ لَا يُحِبُّ الْمُفْسِدِينَ ﴿٦٤﴾ وَلَوْ أَنَّ
أَهْلَ الْكِتَابِ آمَنُوا وَاتَّقَوْا لَكَفَّرْنَا عَنْهُمْ سَيِّئَاتِهِمْ وَلَأَدْخَلْنَاهُمْ جَنَّاتِ النَّعِيمِ ﴿٦٥﴾ وَلَوْ أَنَّهُمْ أَقَامُوا
التَّوْرَاةَ وَالْإِنْجِيلَ وَمَا أُنْزِلَ إِلَيْهِمْ مِنْ رَبِّهِمْ لَأَكَلُوا مِنْ فَوْقِهِمْ وَمِنْ تَحْتِ أَرْجُلِهِمْ

---

**64) (وَقَالَتِ الْيَهُودُ يَدُ اللهِ مَغْلُولَةٌ) – yəhudilər dedilər: “Allah-Təalanın əlləri bağlıdır, xəsisdir, bizə ruzi verməyə xəsislik edir”.** (Yəhudilər Allah-Təalaya asi olduqlarından Allah-Təala onlardan ruzisini kəsdi. O səbəbdən Allah-Təalaya xəsislik xüsusiyyətini isnad etdilər). **(غُلَّتْ أَيْدِيهِمْ وَلُعِنُوا بِمَا قَالُوا) – yəhudilərin öz əlləri bağlanıb, onlardan heç bir xeyir əmələ gəlməsin. Dedikləri sözlərinə görə, Allah-Təalanın rəhmətindən kənar olsunlar. (بَلْ يَدَاهُ مَبْسُوطَتَانِ يُنْفِقُ كَيْفَ يَشَاءُ)** – (Allah-Təala xəsis deyil)**, əksinə, Allah-Təalanın əlləri açıqdır.** (Bütün xalqa ruzi verəndir. Səxavət və lütf qaynağıdır)**. İstədiyinə az, ya da çox verər,** (heç kim ona etiraz edə bilməz. Allah-Təala xəsis deyil, bəlkə, yəhudilərin asiliyinə görə, onlardan ruzini kəsibdir). **(وَلَيَزِيدَنَّ كَثِيرًا مِنْهُمْ مَا أُنْزِلَ إِلَيْكَ مِنْ رَبِّكَ طُغْيَانًا وَكُفْرًا)** – (ey Məhəmməd)**, sənə məndən nazil olan Quran yəhudilərin əksəriyyətinin küfr və inadını artırır. (وَأَلْقَيْنَا بَيْنَهُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاءَ إِلَى يَوْمِ الْقِيَامَةِ) – Qurani-Şərifə qarşı küfr və inadları artdığı üçün onlarla müsəlmanlar arasına qiyamətədək ədavət və düşmənçilik saldıq.** (Heç vaxt nə müsəlman yəhudini, nə də yəhudi müsəlmanı özünə dost tutmaz). **(كُلَّمَا أَوْقَدُوا نَارًا لِلْحَرْبِ أَطْفَأَهَا اللهُ)** – (ey Məhəmməd)**, nə zaman yəhudilər sənə qalib olmaq üçün savaşdan ötrü bir od yandırsalar, Allah-Təala onların odunu söndürüb,** (onları məğlub və zəlil edib səni onlara qalib edibdir. Heç bir savaşda Allah-Təala onlara qələbə verməyib)**. (وَيَسْعَوْنَ فِي الْأَرْضِ فَسَادًا) – indi səy edirlər ki, bəlkə, yer üzündə bir fəsad edib,** (sənə bir əziyyət verib, islamı məhv etsinlər. Heç vaxt onlar islama qalib ola bilməzlər). **(وَاللهُ لَا يُحِبُّ الْمُفْسِدِينَ) – Allah-Təala fəsad edən şəxsləri sevməz.**

**65) (وَلَوْ أَنَّ أَهْلَ الْكِتَابِ آمَنُوا وَاتَّقَوْا) – əgər əhli-kitab** (Hz. Məhəmmədin (ə.s) gətirdiyi Qurana) **iman gətirib, təqva sahibi olub xəbis xüsusiyyətləri özlərindən kənar etsələr, (لَكَفَّرْنَا عَنْهُمْ سَيِّئَاتِهِمْ) – əlbəttə, belə vaxtda onların günahlarını pozub bağışlayarıq. (وَلَأَدْخَلْنَاهُمْ جَنَّاتِ النَّعِيمِ) – əlbəttə, onları axirətdə hər bir nemətin mövcud olduğu cənnətlərə daxil edərik.**

**66) (وَلَوْ أَنَّهُمْ أَقَامُوا التَّوْرَاةَ وَالْإِنْجِيلَ) – əgər* əhli-kitab Tövrat və İncilin ehkamına əməl etsələr, (وَمَا أُنْزِلَ إِلَيْهِمْ مِنْ رَبِّهِمْ) – bir də rəbləri Allah-Təaladan onlara nazil olan Qurana əməl etsələr, (لَأَكَلُوا مِنْ فَوْقِهِمْ وَمِنْ تَحْتِ أَرْجُلِهِمْ) – əlbəttə, onların ruziləri aşıb-daşar, səmadan yağış gələr, yerdən çıxan ruzilərdən**

مِنهُمْ أُمَّةٌ مُقْتَصِدَةٌ وَكَثِيرٌ مِنهُمْ سَاءَ مَا يَعْمَلُونَ ﴿٦٦﴾ يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَبِّكَ
وَإِن لَمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ وَاللَّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ إِنَّ اللَّهَ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ ﴿٦٧﴾

---

**yeyərlər. (مِنهُمْ أُمَّةٌ مُقْتَصِدَةٌ) – əhli-kitabdan ədalət sahibi, əvvəlki kitablara və Qurana iman gətirən bir camaat vardır, (وَكَثِيرٌ مِنهُمْ سَاءَ مَا يَعْمَلُونَ) – amma yəhudilərdən əksəriyyəti nə pis əməl edib, küfr və zəlalətdə qalıblar.**

*(***Qeyd:** Ayə buna dəlildir ki, qəhətlik və ruzinin az olması insanın əməlindəndir. Hər bir millət itaətdən çıxanda Allah-Təala onlardan ruzisini kəsər ki, qəflətdən oyanıb itaətə gəlsinlər. Su insanın həyat qaynağıdır, əgər Allah-Təala öz rəhmətini kəsib yağış göndərməsə, dünyada bir həyat sahibi də qalmaz. Hərçənd materialistlər hər bir şeyi havaya isnad edirlər, amma bu söz onların cəhalətinə dəlildir. Özlərini alim və şüurlu sayıb, şüursuz və iradəsiz havanı xaliq saymaq cəhalət və nadanlıq əlamətidir. Amma ehtiyac zamanı onlar da Allah-Təalaya yönəlib, "Ey susuzlara yardım edən Allah, bizə yardım et," - deyirlər).*

**67) (يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَبِّكَ) – (Allah-Təala iki yerdə "ey rəsul" xitabı ilə peyğəmbərə xitab buyurubdur, biri əvvəldə, biri də budur, buyurur: "Ey peyğəmbər*,**

*(***Qeyd:** Şiə məzhəbinə görə, bu ayə Hz. Əlinin vəlayəti xüsusunda nazil olubdur. Belə rəvayət edirlər ki, Hz. Peyğəmbər vida həccində Qədiri-Xum adlı yerə çatanda orada bu ayə nazil oldu (Təbatəbai, əl-Mizan, VI/50; Təbərsi, Məcməul-Bəyan, II/25-26; Kuleyni, Kafi (Üsul), II/47-48) yəni ey peyğəmbər, Əlinin xilafəti xəbərini xalqa çatdır, əgər çatdırmasan, sanki, Allah-Təalanın hökmlərindən heç bir hökm verməmiş kimisən". O vaxt Hz. Peyğəmbər minbərə çıxıb buyurdu: "Ey insanlar, mən kimin mövlası – sahibi isəm, Əli də onun mövlasıdır, Allahım, onun dostu olanın dostu, düşməni olanın da düşməni ol! (Əhməd b. Hənbəl, Müsnəd, I/119)) Sələbi və Əyyaşi öz təfsirlərində (Təbatəbai, əl-Mizan, III/344) və İbnu Əbi Übeyrin "Şəvahidut-tənzil" kitabında bunu rəvayət ediblər (Təbatəbai, əl-Mizan, III/344). İbn Abbas və Cabir ibn Abdullahdan da belə rəvayət olunubdur (Fərqli rəvayətlər üçün bax: Əhməd b. Hənbəl, Müsnəd, IV/367-380; VI/240; I/84-118-119-152). Şeyx Salman Bəlxi "Yənabiül-Məvəddə" kitabında bu rəvayəti bir neçə yolla nəql edib. Əhli-sünnə bu ayənin Qədiri-Xumda Hz. Əli barəsində nazil olmasını inkar edir, amma hədisi qəbul edib deyirlər: "Bu hədis Hz. Əlinin xilafətinə işarə etmir").*

**Allah-Təaladan sənə nazil olan hər bir hökmü xalqa çatdır, heç kimdən qorxma. (وَإِن لَمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ) – əgər Allah-Təalanın sənə əmr olunan bütün hökmlərini xalqa çatdırmasan, ya da Allah-Təalanın bircə hökmünün çatdırılmasında tənbəllik etsən, ya da tərəfgirlik etsən, o zaman sanki, Allah-Təalanın heç bir hökmünü və peyğəmbərlikdən heç bir şeyi yerinə yetirməmiş kimi olarsan. (وَاللَّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ) – əgər xalqdan qorxun varsa, Allah-Təala səni xalqdan qoruyub mühafizə edər, sənə heç bir zərər yetirə bilməzlər. (إِنَّ اللَّهَ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ) – həqiqətən, Allah-Təala kafirlərə o qüdrəti verməz ki, səni qətlə yetirməyə qadir olsunlar və səni**

قُلْ يَا أَهْلَ الْكِتَابِ لَسْتُمْ عَلَى شَيْءٍ حَتَّى تُقِيمُوا التَّوْرَاةَ وَالْإِنْجِيلَ وَمَا أُنْزِلَ إِلَيْكُمْ مِنْ رَبِّكُمْ
وَلَيَزِيدَنَّ كَثِيرًا مِنْهُمْ مَا أُنْزِلَ إِلَيْكَ مِنْ رَبِّكَ طُغْيَانًا وَكُفْرًا فَلَا تَأْسَ عَلَى الْقَوْمِ الْكَافِرِينَ ﴿٦٨﴾
إِنَّ الَّذِينَ آمَنُوا وَالَّذِينَ هَادُوا وَالصَّابِئُونَ وَالنَّصَارَى مَنْ آمَنَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَعَمِلَ صَالِحًا فَلَا
خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٦٩﴾ لَقَدْ أَخَذْنَا مِيثَاقَ بَنِي إِسْرَائِيلَ وَأَرْسَلْنَا إِلَيْهِمْ رُسُلًا كُلَّمَا
جَاءَهُمْ رَسُولٌ بِمَا لَا تَهْوَى أَنْفُسُهُمْ فَرِيقًا كَذَّبُوا وَفَرِيقًا يَقْتُلُونَ ﴿٧٠﴾

---

**qətl etməyə heç bir yol tapmazlar.** (Hərçənd Hz. Peyğəmbər Allah-Təalanın hökmünü gizlətməyib xalqa çatdırırdı, lakin bu ayə Hz. Peyğəmbəri möhkəm etmək və qorxusunu götürmək, sabitqədəm etməkdən ötrü nazil oldu).

**68) (قُلْ يَا أَهْلَ الْكِتَابِ)** – (ey Məhəmməd)**, de ki, ey əhli-kitab,** (لَسْتُمْ عَلَى شَيْءٍ حَتَّى تُقِيمُوا التَّوْرَاةَ وَالْإِنْجِيلَ وَمَا أُنْزِلَ إِلَيْكُمْ مِنْ رَبِّكُمْ) **– sizə nazil olan Tövrata, İncilə və Qurana əməl etməyənə qədər heç bir haqq olan dində deyilsiniz,** (وَلَيَزِيدَنَّ كَثِيرًا مِنْهُمْ مَا أُنْزِلَ إِلَيْكَ مِنْ رَبِّكَ طُغْيَانًا وَكُفْرًا) – (ey Məhəmməd)**, sənə nazil olan Quran yəhudilərdən çoxunun küfr və inadını artırır. Küfrlərində daha da israr edirlər. (فَلَا تَأْسَ عَلَى الْقَوْمِ الْكَافِرِينَ)** – (ey Məhəmməd)**, bu kafir olan camaatın küfr və inadlarının çox olmasına görə, məhzun və qəmgin olma, onların küfrlərinin zərəri özlərinə qayıdar. Sənə bir zərər gəlməz.**

**69) (إِنَّ الَّذِينَ آمَنُوا وَالَّذِينَ هَادُوا وَالصَّابِئُونَ وَالنَّصَارَى) - həqiqətən, o şəxslər ki Qurana iman gətiriblər, yəhudilər və xristianlar, bir də mələklərə və ulduzlara sitayiş edənlər, (مَنْ آمَنَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَعَمِلَ صَالِحًا) – bu qeyd olunan camaatlardan o şəxslər ki Allah-Təalaya və axirət gününə iman gətirib doğruluq ilə islama daxil olub yaxşı əməl edərlər, (فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ) – onlara axirət əzabından heç bir qorxu yoxdur, məhzun və qəmgin olan da deyillər.**

**70) (لَقَدْ أَخَذْنَا مِيثَاقَ بَنِي إِسْرَائِيلَ وَأَرْسَلْنَا إِلَيْهِمْ رُسُلًا)** – (ey Məhəmməd)**, həqiqətən, biz bəni-İsraildən möhkəm əhd aldıq ki, müvəhhid olub Allah-Təalaya şərik qoşmasınlar.** (Bu əhddən məqsəd Allah-Təalanın insana əmanət verdiyi ağıldır. Allahı bilmək üçün ağıl kifayət edər. Başqa bir şeyə ehtiyac yoxdur). Onlara neçə peyğəmbər göndərdik ki, halal və haramı onlardan ötrü **bəyan edib, Allahı tanımaları üçün onları qəflət yuxusundan oyatsınlar.** (Allahı tanımaları üçün peyğəmbərlərin xalqı qəflətdən oyatması lazımdır). **(كُلَّمَا جَاءَهُمْ رَسُولٌ بِمَا لَا تَهْوَى أَنْفُسُهُمْ) – nə zaman ki peyğəmbərlər bəni-İsrailə onların nəfsani arzularına müvafiq olmayan hökmlərlə gəldi, (فَرِيقًا كَذَّبُوا وَفَرِيقًا يَقْتُلُونَ) – o peyğəmbərlərin bir qismini təkzib edib, o biri qismini qətlə yetirdilər.** (Yeremya, Yeşua, Samuel və bunlardan başqa digər peyğəmbərləri də təkzib etdilər. Yəhya, Zəkəriyyə və İsanı da öz etiqadlarına görə, qətlə yetirdilər).

وَحَسِبُوا أَلَّا تَكُونَ فِتْنَةٌ فَعَمُوا وَصَمُّوا ثُمَّ تَابَ اللَّهُ عَلَيْهِمْ ثُمَّ عَمُوا وَصَمُّوا كَثِيرٌ مِنْهُمْ وَاللَّهُ بَصِيرٌ بِمَا يَعْمَلُونَ ﴿٧١﴾ لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوا إِنَّ اللَّهَ هُوَ الْمَسِيحُ ابْنُ مَرْيَمَ وَقَالَ الْمَسِيحُ يَا بَنِي إِسْرَائِيلَ اعْبُدُوا اللَّهَ رَبِّي وَرَبَّكُمْ إِنَّهُ مَنْ يُشْرِكْ بِاللَّهِ فَقَدْ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ وَمَأْوَاهُ النَّارُ وَمَا لِلظَّالِمِينَ مِنْ أَنْصَارٍ ﴿٧٢﴾ لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوا إِنَّ اللَّهَ ثَالِثُ ثَلَاثَةٍ وَمَا مِنْ إِلَهٍ إِلَّا إِلَهٌ وَاحِدٌ وَإِنْ لَمْ يَنْتَهُوا عَمَّا يَقُولُونَ لَيَمَسَّنَّ الَّذِينَ كَفَرُوا مِنْهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٧٣﴾ أَفَلَا يَتُوبُونَ إِلَى اللَّهِ وَيَسْتَغْفِرُونَهُ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿٧٤﴾

---

**71) (وَحَسِبُوا أَلَّا تَكُونَ فِتْنَةٌ) – yəhudilər belə güman etdilər ki, peyğəmbərləri təkzib edib qətlə yetirdiklərinə görə nə dünyada, nə də axirətdə onlara heç bir əzab olmaz. (فَعَمُوا وَصَمُّوا) – haqqı görməkdən və eşitməkdən gözləri kor və qulaqları kar oldu, belə əməllərə davam etdilər. (ثُمَّ تَابَ اللَّهُ عَلَيْهِمْ) – ondan bir müddət sonra tövbə etdilər. Allah-Təala da onların tövbəsini qəbul etdi. (ثُمَّ عَمُوا وَصَمُّوا كَثِيرٌ مِنْهُمْ) – ondan sonra yenə yəhudilərin çoxu kor, kar olub daha itaətə gəlmədilər. (وَاللَّهُ بَصِيرٌ بِمَا يَعْمَلُونَ) – Allah-Təala yəhudilərin etdiyini görür və onlardan agahdır.**

**72) (لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوا إِنَّ اللَّهَ هُوَ الْمَسِيحُ ابْنُ مَرْيَمَ) – həqiqətən, Allah-Təala İsa Məryəm oğludur, deyənlər kafir oldular. (Allah-Təalanın bu kəlamı xristianlara isnad etməyin təhqiqi - halbuki xristianlar təkcə İsanı Allah saymırdılar - bu surənin 18-ci ayəsinin təfsirində keçdi).** وَقَالَ الْمَسِيحُ يَا بَنِي (إِسْرَائِيلَ اعْبُدُوا اللَّهَ رَبِّي وَرَبَّكُمْ) – (bu nə təəccüblü sözdür ki, dedilər: “Məsih Allah-Təaladır”.) **Halbuki İsa özü onlara dedi: “Ey bəni-İsrail, mənim və sizin rəbbiniz olan bir Allah-Təalaya ibadət edin,** (إِنَّهُ مَنْ يُشْرِكْ بِاللَّهِ فَقَدْ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ وَمَأْوَاهُ النَّارُ) **– həqiqətən, ey bəni-İsrail, kim Allah-Təalaya şərik qoşsa, Allah-Təala ona cənnəti haram edər. Onun məkanı cəhənnəm odudur, oradan xilas ola bilməzlər”.** (İsa bu sözü deyəndə onlar necə deyə bilərdilər ki, İsa Allah-Təaladır). **(وَمَا لِلظَّالِمِينَ مِنْ أَنْصَارٍ)** – (İsa Allah-Təaladır - deyən) **zalımlara bir köməkçi tapılmaz ki, onlara axirət əzabından nicat versin.**

**73) (لَقَدْ كَفَرَ الَّذِينَ قَالُوا إِنَّ اللَّهَ ثَالِثُ ثَلَاثَةٍ) – həqiqətən, Allah-Təala üç Allahdan** (Allah-Təala, Ruhül-qüds və İsa) **biridir, deyənlər kafir oldular, (وَمَا مِنْ إِلَهٍ إِلَّا إِلَهٌ وَاحِدٌ) – halbuki yeganə və şəriksiz olan pak məbuddan başqa, ibadətə layiq olan yoxdur. (وَإِنْ لَمْ يَنْتَهُوا عَمَّا يَقُولُونَ) – əgər xristianlar dedikləri bu sözü tərk etməsələr, (لَيَمَسَّنَّ الَّذِينَ كَفَرُوا مِنْهُمْ عَذَابٌ أَلِيمٌ) – əlbəttə, bunların bu küfr sözlərində sabit olub onu tərk etməyənlərə qiyamət günündə şiddətli əzab yetişər.**

**74) (أَفَلَا يَتُوبُونَ إِلَى اللَّهِ وَيَسْتَغْفِرُونَهُ) – bəs bu sözlərindən tövbə edib, bağışlanmalarını diləyib Allah-Təala tərəfinə qayıtmazlar? (وَاللَّهُ غَفُورٌ رَحِيمٌ) – əgər tövbə etsələr, Allah-Təala tövbələrini qəbul edib, onların günahını bağışlayıb rəhm edəndir.**

مَا الْمَسِيحُ ابْنُ مَرْيَمَ إِلَّا رَسُولٌ قَدْ خَلَتْ مِنْ قَبْلِهِ الرُّسُلُ وَأُمُّهُ صِدِّيقَةٌ كَانَا يَأْكُلَانِ الطَّعَامَ انْظُرْ
كَيْفَ نُبَيِّنُ لَهُمُ الْآيَاتِ ثُمَّ انْظُرْ أَنَّى يُؤْفَكُونَ ﴿٧٥﴾ قُلْ أَتَعْبُدُونَ مِنْ دُونِ اللَّهِ مَا لَا يَمْلِكُ لَكُمْ
ضَرًّا وَلَا نَفْعًا وَاللَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿٧٦﴾ قُلْ يَا أَهْلَ الْكِتَابِ لَا تَغْلُوا فِي دِينِكُمْ غَيْرَ الْحَقِّ وَلَا
تَتَّبِعُوا أَهْوَاءَ قَوْمٍ قَدْ ضَلُّوا مِنْ قَبْلُ وَأَضَلُّوا كَثِيرًا وَضَلُّوا عَنْ سَوَاءِ السَّبِيلِ ﴿٧٧﴾

---

**75)** (مَا الْمَسِيحُ ابْنُ مَرْيَمَ إِلَّا رَسُولٌ قَدْ خَلَتْ مِنْ قَبْلِهِ الرُّسُلُ) – **İsa Məryəm oğlu özündən əvvəl olan peyğəmbərlər kimi bir peyğəmbərdir, Allah-Təala onlara möcüzə verdiyi kimi, İsaya da möcüzə bəxş etmişdi.** (وَأُمُّهُ صِدِّيقَةٌ) – **anası Məryəm də Allah-Təalanı təsdiq edən və peyğəmbərlərə iman gətirəndir. Necə ki ondan başqa qadınlar da olub ki, peyğəmbərləri təsdiq ediblər. İsa və anası hər ikisi insan cinsindəndirlər, onlara insanda olmayan xüsusiyyətləri isnad etmək layiq deyildir.** (كَانَا يَأْكُلَانِ الطَّعَامَ) – **İsa və Məryəmin xüsusiyyətləri budur ki, qidaya ehtiyacları olub yemək yeyərdilər. Necə ki insanlar yeyir.** (Yeməyə ehtiyacı olan şey, gərək ət, sümük, qandan ibarət olan bir cism olsun. Onun, gərək, sinir və damarları olsun. Şəhvəti və digər nəfsani arzuları gərək olsun. Bir də yemək yeyənin ayaqyoluna getməyə də ehtiyacı olar, İsa və Məryəmdə bu xüsusiyyətlər var idi. Allah-Təala zalımların dediyi belə xüsusiyyətlərdən ucadır). (انْظُرْ كَيْفَ نُبَيِّنُ لَهُمُ الْآيَاتِ) – (ey Məhəmməd)**, bax gör ki, onların İsanı Allah bilməsinin batil olması haqda necə aşkar olan dəlillər bəyan edirik.** (ثُمَّ انْظُرْ أَنَّى يُؤْفَكُونَ) – (ey Məhəmməd)**, bu dəlilləri bəyan edəndən sonra bax gör ki, necə haqdan dönüb, haqq sözə qulaq asmayıb, həmin küfr sözlərində qalırlar.**

**76)** (قُلْ أَتَعْبُدُونَ مِنْ دُونِ اللَّهِ مَا لَا يَمْلِكُ لَكُمْ ضَرًّا وَلَا نَفْعًا) – **(ey Məhəmməd, de ki, bəs Allah-Təalanı qoyub, sizə nə bir zərər, nə də bir mənfəət verməyə malik və ixtiyar sahibi olmayan başqasına** (İsaya) **ibadət edirsiniz?** (وَاللَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ) – **bəs Allah-Təalaya necə şərik qoşursunuz? Halbuki Allah-Təala sizin danışan sözlərinizi eşidib etiqadlarınızdan agahdır.** (Bəs belə qadir olan Allah-Təalanı qoyub İsa kimi aciz şəxsə ibadət edilərmi?)

**77)** (قُلْ يَا أَهْلَ الْكِتَابِ لَا تَغْلُوا فِي دِينِكُمْ غَيْرَ الْحَقِّ) – (ey Məhəmməd)**, de ki, ey əhli-kitab, həddinizi aşıb dininiz üçün haqdan başqa batil sözlər deməyin.** (وَلَا تَتَّبِعُوا أَهْوَاءَ قَوْمٍ قَدْ ضَلُّوا مِنْ قَبْلُ) – **ey əhli-kitab, Hz. Məhəmmədin peyğəmbərliyindən qabaq da zəlalətdə olan bir camaatın** (alimlərinizin) **nəfsani istəklərinə tabe olmayın.** (وَأَضَلُّوا كَثِيرًا) – **özləri zəlalətdə olmaqla birlikdə, bir çox camaatı da zəlalətə salıb onlardan ötrü bidətlər düzəldiblər.** (وَضَلُّوا عَنْ سَوَاءِ السَّبِيلِ) – **Hz. Məhəmmədin gəlməsindən sonra da asi olub, onu təkzib edib düz yoldan uzaq düşdülər.**

لُعِنَ الَّذِينَ كَفَرُوا مِنْ بَنِي إِسْرَائِيلَ عَلَى لِسَانِ دَاوُودَ وَعِيسَى ابْنِ مَرْيَمَ ذَلِكَ بِمَا عَصَوْا وَكَانُوا يَعْتَدُونَ
﴿٧٨﴾ كَانُوا لَا يَتَنَاهَوْنَ عَنْ مُنْكَرٍ فَعَلُوهُ لَبِئْسَ مَا كَانُوا يَفْعَلُونَ ﴿٧٩﴾ تَرَى كَثِيرًا مِنْهُمْ يَتَوَلَّوْنَ الَّذِينَ
كَفَرُوا لَبِئْسَ مَا قَدَّمَتْ لَهُمْ أَنْفُسُهُمْ أَنْ سَخِطَ اللَّهُ عَلَيْهِمْ وَفِي الْعَذَابِ هُمْ خَالِدُونَ ﴿٨٠﴾ وَلَوْ كَانُوا
يُؤْمِنُونَ بِاللَّهِ وَالنَّبِيِّ وَمَا أُنْزِلَ إِلَيْهِ مَا اتَّخَذُوهُمْ أَوْلِيَاءَ وَلَكِنَّ كَثِيرًا مِنْهُمْ فَاسِقُونَ ﴿٨١﴾

---

**78) (لُعِنَ الَّذِينَ كَفَرُوا مِنْ بَنِي إِسْرَائِيلَ عَلَى لِسَانِ دَاوُودَ وَعِيسَى ابْنِ مَرْيَمَ) – bəni-İsraildən kafir olan şəxslərə Davud, bir də İsa Məryəm oğlunun dili ilə lənət edildi.** (Yəni Allah-Təala Zəbur və İncildə bəni-İsraildən kafir olanlara lənət edibdir). **(ذَلِكَ بِمَا عَصَوْا وَكَانُوا يَعْتَدُونَ) – bəni İsrailə lənət olunmasının səbəbi Allah-Təalaya asi olub, həddi aşıb zalım olmaları idi.**

**79) (كَانُوا لَا يَتَنَاهَوْنَ عَنْ مُنْكَرٍ فَعَلُوهُ) – *bəni-İsrail pis və qəbih əməllər edib, bir-birilərinə qəbih olan əməlləri qadağan etmirdilər. (لَبِئْسَ مَا كَانُوا يَفْعَلُونَ) – bəni-İsrailin etdikləri** (bir-birilərinə pis əməlləri qadağan etməməsi) **nə pis əməldir.**

*(****Qeyd:*** *Vay olsun müsəlmanlara, birdəfəlik Allah-Təalanın kəlamından üz döndərib pis əməlləri qadağan etməyi tərk ediblər. Sanki islam ümmətinin etdiyi pis əməllər islamın öz qanunudur. Onu qadağan etməyin əvəzinə pis əməlləri daha da təşviq edirlər. Adlarını müsəlman qoyub, Quran əllərində olub oxuduqları halda xəbis nəfsləri ilə hiyləbazlıq edirlər. Bu zamanda Quranın hökmü birdəfəlik hökmsüz edilib, sanki, Qurani-Şərif ölü üstündə oxunmaq üçün nazil olubdur, halbuki Quranın mənfəəti dirilərdən ötrüdür. Sabah Allahın hüzurunda əgər bizdən soruşsalar ki, Quranla necə rəftar etdiniz, bizim cavabımız nə olacaqdır? Müqəddəs islam şəriətinin sahibi dünyadan gedəndə buyurdu: "Mən sizin aranızda iki qiymətli şey qoyub gedirəm, görüm onlarla necə rəftar edəcəksiniz. Biri o birisindən böyükdür. Böyük olan Allah-Təalanın kitabıdır, kiçik olan mənim əzizim əhli-beytimdir" (Tirmizi, Menaqib 31; Əhməd b. Hənbəl, Müsnəd, III/41-17-26-59; V/182). Bəs şəriət sahibinin bu fərmanını islam ümməti düşünürmü? Hətta deyə bilərik ki, bu dövrdə Hz. Peyğəmbərin bu fərmanı birdəfəlik hökmsüz edilibdir).*

**80) (تَرَى كَثِيرًا مِنْهُمْ)** – (ey Məhəmməd)**, əhli-kitabdan bir çox münafiq şəxsi görərsən ki, (يَتَوَلَّوْنَ الَّذِينَ كَفَرُوا) – müşrikləri dost tutub onlara meyil edirlər. (لَبِئْسَ مَا قَدَّمَتْ لَهُمْ أَنْفُسُهُمْ أَنْ سَخِطَ اللَّهُ عَلَيْهِمْ) – onların nəfsləri özləri üçün qabaqcadan axirətə nə pis şey göndəribdir,** (göndərdikləri şey budur ki, müşrikləri dost tutmaq səbəbinə Allah-Təala onlara qəzəb edibdir). **(وَفِي الْعَذَابِ هُمْ خَالِدُونَ) – həmişə Allah-Təalanın əzabında olub xilas olmayacaqlar.**

**81) (وَلَوْ كَانُوا يُؤْمِنُونَ بِاللَّهِ وَالنَّبِيِّ وَمَا أُنْزِلَ إِلَيْهِ) – əgər o münafiqlər Allah-Təalaya iman gətirib Hz. Məhəmmədi və ona nazil olan Quranı təsdiq etmiş olsaydılar, (مَا اتَّخَذُوهُمْ أَوْلِيَاءَ) – müşrikləri özlərinə dost tutmazdılar. (وَلَكِنَّ كَثِيرًا مِنْهُمْ فَاسِقُونَ) – lakin münafiqlərin çoxu küfr və nifaqlarında inadkar olub heç vaxt onlardan xeyir əmələ gəlməz.**

لَتَجِدَنَّ أَشَدَّ النَّاسِ عَدَاوَةً لِلَّذِينَ آمَنُوا الْيَهُودَ وَالَّذِينَ أَشْرَكُوا وَلَتَجِدَنَّ أَقْرَبَهُمْ مَوَدَّةً لِلَّذِينَ آمَنُوا الَّذِينَ قَالُوا إِنَّا نَصَارَى

---

**82) (لَتَجِدَنَّ أَشَدَّ النَّاسِ عَدَاوَةً لِلَّذِينَ آمَنُوا الْيَهُودَ وَالَّذِينَ أَشْرَكُوا)** – (ey Məhəmməd)**, əlbəttə, insanlardan möminlərə çox ədavətli olanların - yəhudilər, bir də müşriklər olduğunu görərsən.** (İslam ümmətinə çox ədavətli olan bu iki qrupdur)**. (وَلَتَجِدَنَّ أَقْرَبَهُمْ مَوَدَّةً لِلَّذِينَ آمَنُوا الَّذِينَ قَالُوا إِنَّا نَصَارَى)** – (ey Məhəmməd)**,***

*(****Qeyd:** *Məkkədə Qüreyş tayfası Hz. Peyğəmbərin təbliğə başlamasından sonra 5 il müsəlmanları öz dinlərindən döndərməyə çalışıb, hər tayfa öz içlərindən olan müsəlmanlara əziyyət etməyə başladılar ki, bəlkə onları islamdan döndərə bilsinlər. Amma Hz. Peyğəmbəri əmisi Əbu Talib mühafizə etdi. Hz. Peyğəmbər baxıb gördü ki, səhabələrə əziyyət edirlər və onlara kömək etməyə qadir deyildir. Bu səbəbdən buyurdu ki, buradan çıxıb Həbəşistana gedin, orada saleh bir padşah vardır, nə zülm etməz, nə də onun yanında zülm olunmaz. Həbəşistanda padşah xristian olan Nəcaşi idi. 11 kişi 4 qadın Məkkədən gizlicə çıxdılar. 1-Osman ibn Əffan və onun xanımı Ruqiyyə (Hz. Peyğəmbərin qızı), 2- Zübeyr ibn Əvvam 3- Abdullah ibn Məsud 4- Əbdürrəhman ibn Əfv 5- Əbu Xuzeyfə ibn Əqəbə və onun xanımı Sahlə* ***(Süheyl ibn Ömərin qızı)*** *6- Müs`əb ibn Ümeyir 7-Əbu Sələmə ibn Əbdüləsəd və xanımı Ümmü Sələmə* ***(Ümeyyənin qızı)****. 8-Osman ibn Mə`zun 9- Amir ibn Rəbiyyə və xanımı Leyli* ***(Əbu Xeysə qızı)*** *10-Hatib ibn Əmr 11- Süheyl ibn Bəyza dəniz sahilinə gəlib, buradan yarım dinara bir gəmi kiralayıb, Həbəşistana getdilər. İslamda ilk hicrət edənlər bunlardır və ondan sonra Cəfər ibn Əbu Talib hicrət etdi. Ondan sonra müsəlmanlar bir-bir, iki-iki hicrət etdilər. Belə ki, qadın və uşaqlardan başqa 83 nəfər kişi Həbəşistanda toplandı. Məkkə əhli müşriklərdən Əmr ibn Ası, bir də Əmmarə ibn Vəlidi bir sıra töhfələrlə Nəcaşinin yanına göndərdilər ki, Nəcaşi müsəlmanları onlara qaytarsın. Gəlib gəmiyə daxil olub yola düşdülər, Əmmarə ibn Vəlid yaraşıqlı bir cavan və gəzəyən idi. Gəmidə şərab içdilər. Əmr ibn Asın xanımı onun yanında idi. Əmmarə Əmrə dedi ki, xanımına de, mənim üzümdən öpsün. Əmr qəzəblənib, Əmmarəyə pis sözlər dedi. Əmmarə sakitləşdi. Əmr ibn As ayaqyolu etmək üçün gəminin kənarında oturanda Əmmarə onu dənizə saldı. Əmr gəmidən yapışdı, gəmidəkilər də onu xilas etdilər. Hələ Həbəşistana çatmamış Allah-Təala onların arasına ədavət saldı. Ondan sonra Nəcaşinin hüzuruna varid oldular. Əmr ibn As dedi: "Ey hökmdar, bizim aramızdan bir şəxs çıxıb, müdriklərimizə səfeh, dinimizə batil və məbudlarımıza yalançı deyir. Öz adamlarından bir qrupu bura göndərib ki, sənin camaatını da dinlərindən çıxartsın. Onları bizə ver ki, aparıb cəzalarını verək". Nəcaşi dedi: "Gərək onları sorğu-sual edəm". Əmr buyurdu, müsəlmanlar hazır oldular. Müsəlmanlar öz aralarından Cəfər ibn Əbu Talibi padşahla sual-cavab etməyə vəkil seçdilər. Padşah müsəlmanlara dedi: "Bunlar gəliblər sizi aparmağa, nə deyirsiniz?" Cəfər cavab verdi: "Ey padşah, onlardan soruş ki, biz onların qulamıyıq, qaçmışıq ki, bizi gəliblər aparmağa?" Əmr dedi: "Xeyr, azad şəxslərdirlər". Cəfər dedi: "Bəs onlara borcluyuq ki, borc dalınca gəliblər?" Amr dedi: "Borclu deyillər". Cəfər dedi: "Bəlkə onlardan birini öldürmüşük ki, gəliblər, bizdən intiqam alsınlar?" Əmr dedi: "Adam öldürməyiblər". Cəfər dedi: "Bəs bizdən nə istəyirsiniz? Bizə əziyyət etdiniz, biz*

ذَلِكَ بِأَنَّ مِنْهُمْ قِسِّيسِينَ وَرُهْبَانًا وَأَنَّهُمْ لَا يَسْتَكْبِرُونَ ﴿٨٢﴾ وَإِذَا سَمِعُوا مَا أُنْزِلَ إِلَى الرَّسُولِ تَرَى أَعْيُنَهُمْ تَفِيضُ مِنَ الدَّمْعِ مِمَّا عَرَفُوا مِنَ الْحَقِّ يَقُولُونَ رَبَّنَا آمَنَّا فَاكْتُبْنَا مَعَ الشَّاهِدِينَ ﴿٨٣﴾ وَمَا لَنَا لَا نُؤْمِنُ بِاللَّهِ وَمَا جَاءَنَا مِنَ الْحَقِّ وَنَطْمَعُ أَنْ يُدْخِلَنَا رَبُّنَا مَعَ الْقَوْمِ الصَّالِحِينَ ﴿٨٤﴾

---

*də gəlib burada bu padşaha sığınmışıq". Ondan sonra Cəfər dedi: "Ey padşah, Allah-Təala bizə bir peyğəmbər göndərib, bizi namaza, oruca, qohumlara yaxşılıq etməyə, iffət və ismətə, ədalət və ehsana çağırır. Zina və homoseksuallığı, qətli, oğurluğu, zülmü qadağan edir". Nəcaşi dedi: "Allah-Təala İsanı da bu hökmlərlə göndəribdir". Ondan sonra Cəfərə dedi: "Sahibinə gələn hökmlərdən və sözlərdən yadında bir şey varmı ki, deyəsən?" Cəfər Məryəm surəsini oxumağa başladı, hansı ki İsa və Məryəmin əhvalatı orada qeyd olunubdur. Elə ki Cəfər Məryəm surəsini oxudu, məclisdə olan bütün alimlər, abidlər və padşah ağladı. Padşah dedi: "Budur haqq olan sözlər". Əmr ibn As yenidən dedi: "Ey padşah, bunları bizə ver, aparaq Məkkəyə". Padşah Əmrin üzünə bir sillə vurub hökm etdi ki, onların töhfələrini qaytarıb özlərini də şəhərdən çıxartsınlar. Ondan sonra Cəfərə dedi: "Siz mənim vilayətimdə amandasınız". Cəfər Xeybər fəthinə qədər orada qaldı. Sonra Hz. Peyğəmbərin hüzuruna qayıtdı. Bu səbəbdən Allah-Təala bu ayədə xristianları vəsf edir. Bəli, insaflı şəxslər həmişə haqqa tabe olarlar.)*

**əlbəttə, məhəbbət və dostluqda müsəlmanlara yaxın olaraq əhli-kitabdan xristianları görərsən.** (ذَلِكَ بِأَنَّ مِنْهُمْ قِسِّيسِينَ وَرُهْبَانًا وَأَنَّهُمْ لَا يَسْتَكْبِرُونَ) – (xristianların müsəlmanlara məhəbbət bəsləməsinin) **səbəbi odur ki, onlardan yaxşı alimlər və abidlər vardır. (Onları pis yoldan saxlayıb, elmin qədir-qiymətini, Qurani-Şərifin yaxşılığını dərk edib, o səbəbdən müsəlmanlara məhəbbət bəsləyib, onları dost tutarlar və həqiqətən), özləri də təvazökar, təkəbbür etməyən şəxslərdirlər.** (Bu ayənin ehtiva etdiyi böyük siyasi mənaya diqqət edilsin)**.**

**83) (وَإِذَا سَمِعُوا مَا أُنْزِلَ إِلَى الرَّسُولِ)** – (ey Məhəmməd)**, bu xristianlar elə incə qəlblidirlər ki, sənə nazil olan ayələri eşidəndə, (تَرَى أَعْيُنَهُمْ تَفِيضُ مِنَ الدَّمْعِ) (مِمَّا عَرَفُوا مِنَ الْحَقِّ) - Quranın haqq olmasının və kəlmələrinin şirinliyinin təsirindən onların gözlərinin yaşla dolub, gözlərindən yaş töküldüyünü görərsən. (يَقُولُونَ رَبَّنَا آمَنَّا) – belə deyərlər: "Ey bizim rəbbimiz, bu Qurana iman gətirdik. (فَاكْتُبْنَا مَعَ الشَّاهِدِينَ) – bizi Haqqa şahidlik edənlərlə bir yerə yaz".** (Həbəşistan padşahı Nəcaşi iman gətirib Hz. Peyğəmbərə töhfələr göndərdi. Hz. Peyğəmbər onun ölüm xəbərini eşidəndə Allahdan bağışlanmasını istədi).

**84) (وَمَا لَنَا لَا نُؤْمِنُ بِاللَّهِ وَمَا جَاءَنَا مِنَ الْحَقِّ)** – (yenə xristianlar dedilər:) **nə olub bizə və bizə nə mane olub ki, bir olan Allah-Təalaya və Allah-Təalanın bizə nazil etdiyi haqq olan Qurana iman gətirməyək? (وَنَطْمَعُ أَنْ يُدْخِلَنَا رَبُّنَا مَعَ الْقَوْمِ الصَّالِحِينَ) – necə olar ki, rəbbimiz Allah-Təalanın bizi saleh olan camaatla bir yerə daxil etməsini umduğumuz halda iman gətirməyək?**

فَأَثَابَهُمُ اللَّهُ بِمَا قَالُوا جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا وَذَلِكَ جَزَاءُ الْمُحْسِنِينَ ﴿٨٥﴾
وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِآيَاتِنَا أُولَئِكَ أَصْحَابُ الْجَحِيمِ ﴿٨٦﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تُحَرِّمُوا
طَيِّبَاتِ مَا أَحَلَّ اللَّهُ لَكُمْ وَلَا تَعْتَدُوا إِنَّ اللَّهَ لَا يُحِبُّ الْمُعْتَدِينَ ﴿٨٧﴾

---

**85) (فَأَثَابَهُمُ اللَّهُ بِمَا قَالُوا) – Allah-Təala ixlas və etiqadla dedikləri sözlərinə görə, xristianlara bu mükafatı verdi: (جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا) – ağaclarının və qəsrlərinin altından çaylar axan cənnət bağları. (وَذَلِكَ جَزَاءُ الْمُحْسِنِينَ) – yaxşı əməl edənlərin mükafatı bu cənnətlərdir.**

**86) (وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِآيَاتِنَا) – əhli-kitabdan o şəxslər ki kafir olub bizim möcüzələrimizi təkzib etdilər, (أُولَئِكَ أَصْحَابُ الْجَحِيمِ) – onlar cəhənnəm əzabında olanlardır.**

**87) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirən şəxslər, (لَا تُحَرِّمُوا طَيِّبَاتِ مَا أَحَلَّ اللَّهُ لَكُمْ) – Allah-Təalanın sizə halal etdiyi ləziz və təmiz şeyləri özünüzə haram etməyin,** (bir gün Hz. Peyğəmbər vəz edib xalqı Allah-Təalanın qiyamət günündəki əzabı ilə qorxutdu. Səhabələr xeyli qorxdu. Onlardan 10 nəfər Osman ibn Mazuun evində toplanıb, söz verdilər ki, ət və yağ yeməyib, ətirdən istifadə etməyib, qadına yaxınlaşmasınlar, dünyanın bütün ləzzətli şeylərini tərk edib tənasül alətlərini kəssinlər, köhnə libas geyinib, gündüzlər oruc tutub, gecələr ibadət etsinlər. Bəlkə, o zaman Allah-Təalanın əzabından xilas olarlar. Bu əməllərə söz verən 10 nəfər şəxs bunlardır: 1-Osman ibn Mazuun 2-Əli ibn Əbu Talib 3-Abdullah ibn Məsud 4-Əbu Bəkir 5-Abdullah ibn Ömər 6-Əbu Zərr 7-Salim (Əbu Huzeyfənin qulamı) 8-Miqdad ibn Əsvəd 9-Səlman Farisi 10-Maqil ibn Muqarrin. Hz. Peyğəmbər bundan xəbərdar olub, onları çağırıb buyurdu: "Mən tərki-dünyaya əmr* olunmamışam, mən oruc tuturam, iftar da edirəm, ət və yağ yeyirəm və qadınlarla da birlikdə oluram. İslamda rahiblik və tərki-dünyalıq yoxdur, siz də gərək mənə tabe olasınız" (Buxari, Nikah 1; Müslüm, Nikah 5; Nəsai, Nikah 4). O vaxt bu gələn ayə nazil oldu). **(وَلَا تَعْتَدُوا إِنَّ اللَّهَ لَا يُحِبُّ الْمُعْتَدِينَ) – Allah-Təalanın halal etdiyi şeylərdən həddi aşıb, haram şeylərin tərəfinə keçməyin. Həqiqətən, Allah-Təala halaldan keçib harama yönələnləri sevməz. Nə halal şeyi özünüzə haram edin, nə də harama qoşulun.** (İslamda rahib olub tərki-dünya olmaq haramdır).

*(*Qeyd: İslam ümməti Hz. Peyğəmbərin hikmətli əməlinə baxsınlar ki, necə dünya və axirət üçün birlikdə çalışmağı əmr edir. Tərki-dünya edib xalqa ağır yük olmağa razı olmur. Tərki-dünya edib heç bir işlə məşğul olmamaq tənbəllərin əməlidir. Hz. Peyğəmbər razı olmur ki, onun ümməti dünyada dilənçilik edib, kiməsə əl açsın, biz islam ümməti özümüzü millətlər arasında rüsvay etmişik. Xüsusən, o şəxslər ki Hz. Peyğəmbərə isnad edib özlərini onun övladı hesab edirlər. Amma dilənçiliyi özlərinə şüar edib, xalqa onlara qənimətdən olan xümsü verməyi təklif edib islam dininə böyük ar gətirirlər. Bəs şəriət sahibi buna razı olarmı? Belə şəxsləri özünə övlad, ya da ümmət hesab edərmi? Ar olsun müsəlmanlara!)*

وَكُلُوا مِمَّا رَزَقَكُمُ اللَّهُ حَلالًا طَيِّبًا وَاتَّقُوا اللَّهَ الَّذِي أَنْتُمْ بِهِ مُؤْمِنُونَ ﴿٨٨﴾ لَا يُؤَاخِذُكُمُ اللَّهُ بِاللَّغْوِ
فِي أَيْمَانِكُمْ وَلَكِنْ يُؤَاخِذُكُمْ بِمَا عَقَّدْتُمُ الْأَيْمَانَ فَكَفَّارَتُهُ إِطْعَامُ عَشَرَةِ مَسَاكِينَ مِنْ أَوْسَطِ
مَا تُطْعِمُونَ أَهْلِيكُمْ أَوْ كِسْوَتُهُمْ أَوْ تَحْرِيرُ رَقَبَةٍ فَمَنْ لَمْ يَجِدْ فَصِيَامُ ثَلَاثَةِ أَيَّامٍ ذَلِكَ كَفَّارَةُ
أَيْمَانِكُمْ إِذَا حَلَفْتُمْ وَاحْفَظُوا أَيْمَانَكُمْ كَذَلِكَ يُبَيِّنُ اللَّهُ لَكُمْ آيَاتِهِ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٨٩﴾ يَا
أَيُّهَا الَّذِينَ آمَنُوا إِنَّمَا الْخَمْرُ وَالْمَيْسِرُ وَالْأَنْصَابُ وَالْأَزْلَامُ

---

**88) (وَكُلُوا مِمَّا رَزَقَكُمُ اللَّهُ حَلَالًا طَيِّبًا) – Allah-Təalanın sizə verdiyi ruzilərdən halal və pak olanı yeyib heç vaxt özünüzü sıxıntıya salmayın. (وَاتَّقُوا اللَّهَ الَّذِي أَنْتُمْ بِهِ مُؤْمِنُونَ) – iman etdiyiniz Allah-Təaladan qorxub, haram olan şeyləri yeməyin.** (Sıradakı ayə and içmək barəsində nazil olubdur. Şəxs əgər qəsdən and içsə, ondan sonra andını pozsa, gərək kəffarə versin. Necə ki ayədə qeyd olunur, amma gərək Allah-Təalaya and içilsin, Allah-Təaladan başqa heç bir şəxsə və heç bir şeyə and içmək olmaz. Əgər bir şəxs and içsə də batildir və hər bir şəxs and içəndə - vallah, billah, ya da tallah, desə, şəriətdə mötəbər olan anddır, əgər pozsa, gərək, kəffarə versin).

**89) (لَا يُؤَاخِذُكُمُ اللَّهُ بِاللَّغْوِ فِي أَيْمَانِكُمْ) – əgər niyyətiniz olmadan boş yerə and içsəniz, Allah-Təala sizi sorğu-sual edib əzab etməz. (وَلَكِنْ يُؤَاخِذُكُمْ بِمَا عَقَّدْتُمُ الْأَيْمَانَ) – amma qəsdən Allah-Təalaya and içib sonra o andı pozsanız, Allah-Təala sizə əzab edər. (فَكَفَّارَتُهُ إِطْعَامُ عَشَرَةِ مَسَاكِينَ) – əgər belə andı pozsanız, onun kəffarəsi bu 3 şeydən biridir: ya 10 nəfər yoxsula bir dəfə yemək vermək. (مِنْ أَوْسَطِ مَا تُطْعِمُونَ أَهْلِيكُمْ) – o yoxsullara verdiyiniz yemək gərək öz ailənizə verdiyiniz yeməyin orta hallısı kimi olsun, (nə ən yaxşısı olsun, nə də hamısından əskik olsun). (أَوْ كِسْوَتُهُمْ) – ya da 10 nəfər yoxsula özlərinə münasib libas vermək. (أَوْ تَحْرِيرُ رَقَبَةٍ) – ya da bir qulam azad etmək. Bu qeyd olunan 3 şeydən biri kəffarədə kifayət edər. (فَمَنْ لَمْ يَجِدْ) – kim bu qeyd olunan 3 şeyin heç birini tapmadı, kəffarə versin. (فَصِيَامُ ثَلَاثَةِ أَيَّامٍ) – o şəxs, gərək, 3 gün oruc tutsun. (ذَلِكَ كَفَّارَةُ أَيْمَانِكُمْ إِذَا حَلَفْتُمْ) – and içəndən sonra onu pozduğunuz zaman sizin andların kəffarəsi budur: (وَاحْفَظُوا أَيْمَانَكُمْ) – nə zaman ki and içdiniz, andı mühafizə edib pozmayın. (كَذَلِكَ يُبَيِّنُ اللَّهُ لَكُمْ آيَاتِهِ) –Allah-Təala sizdən ötrü öz şəriət ehkamını belə bəyan edir: (لَعَلَّكُمْ تَشْكُرُونَ) – əlbəttə, sizə vacibdir ki, Allah-Təalanın nemətlərinə şükür edəsiniz ki, sizdən ötrü asan hikmət üzrə hökmlər veribdir. Əgər onların hikmətlərinə agah olsanız, o vaxt daha çox şükür edərsiniz.** (Bu növbəti ayə şərab, qumar, bütpərəstlik və falçılığın haram olması barəsində nazil olubdur).

**90) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirən şəxslər, (إِنَّمَا الْخَمْرُ وَالْمَيْسِرُ وَالْأَنْصَابُ وَالْأَزْلَامُ) – həqiqətən*, şərab ( yəni insanı sərxoş edib ağlını başdan alan hər şey, bu kimi şeylərə ərəb – "xəmr" deyir) və qumar** (hər növü) **və bir şey**

رِجْسٌ مِنْ عَمَلِ الشَّيْطَانِ فَاجْتَنِبُوهُ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٩٠﴾ إِنَّمَا يُرِيدُ الشَّيْطَانُ أَنْ يُوقِعَ بَيْنَكُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاءَ فِي الْخَمْرِ وَالْمَيْسِرِ

---

**qoyub ona sitayiş etmək** (Necə ki Məkkədə bütləri və daşları ibadətdən ötrü qoymuşdular) **və fal açmaq** (hər növü)**, bunların hamısı haramdır.**

*(*Qeyd: Bu axırıncı ayədir ki, şərab və qumarın haram olması haqda nazil olub, açıq-aşkar haram olması qeyd edilibdir. Belə ki heç bir şəxsdən ötrü onların haram olması haqqında bəhanəsi qalmasın. Bəzi təəssübkeş müsəlmanlar islam dininin haqlılığı haqda əsərlər yazıb nəşr edirlər. Ya da məclislərdə islami qeyrətdən və şərəfdən bəhs edib, amma xalqı Avropa elmlərinin təhsilinə təşviq edirlər. Özlərini elmdə mövqe və fəzilət sahibi saydıqlarından islamı sevən, hətta islamın himayədarı kimi göstərirlər. Bəs bu ayəni eşitməyiblər ki, şərab məclislərində işirak edib içki içərkən bu ayəni yadlarına salıb qədəhi yerə qoysunlar? Ya da qumar məclislərində iştirak edib qumarbazlarla birlikdə qumar oynayanda bu ayəni yada salıb qumarı tərk etsinlər? Heyhat! Necə ola bilər ki, bir şəxs islamda haram olan şeylərə qoşulub, sonra islamın rəvac tapmasını istəsin? Belə şəxslər hidayət yolundan son dərəcə uzaq düşüblər. Hərçənd özlərini islamın himayədarı sayırlar. Avropanın hikmət və elm sahibləri həmişə arzu edirlər ki, bəlkə, əyyaşlıq və qumarbazlığı tərk etsinlər. Amma müsəlmanlar öz dinlərində bu kimi şeylər haram ola-ola ona düçar olurlar. Əgər dinin qanununa, haram və halalına əməl olunmasa, din və millətin inkişafi haqda sadəcə əsərlər yazmağın nə faydası var? ..... İslamın inkişaf edə bilməsinin ilk şərti xeyri əmr etmək, şəri qadağan etməkdir. Bir şəxs ki, adını müsəlman qoyub, Quranda qeyd olunan açıq-aşkar haramları edəndən sonra yenə iddia etsə ki, mən dinpərəstəm, ya da islamın himayədarıyam (Necə ki deyirlər), axmaqlıq və səfehlikdir, hətta islama istehza etməkdir. İslamın ilk dövründə ona rəvac verən şeylər o şəxslər olublar ki, səcdənin çoxluğundan alınları qabar olmuşdu. Şərab içib, sərxoş olub, ağlın başdan getməsi ilə islama himayədarlıq edilməz.*

*Ey islamın ölüm xəbərini verən bədxah carçı, şəriət öldü, kafir ortaya çıxdı.*

*Hz. Əli ibn Əbu Talib (ə.s), öz divanında zəmanəmizə müvafiq nə gözəl buyurubdur: "İslamı qurana müjdə olsun, sən onun sütununu və dirəklərini yıxdın,*

*İslam getdi, sadəcə xarabalığı qaldı, insanların artıq çox azı ona ehtiyac hiss edir".*

**(رِجْسٌ مِنْ عَمَلِ الشَّيْطَانِ) – bu qeyd olunanlar şeytan əməlindən xəbis olan şeylərdir. (فَاجْتَنِبُوهُ لَعَلَّكُمْ تُفْلِحُونَ) – bu şeylərdən çəkinib tərk edin. Bunların tərkində sizdən ötrü axirət əzabından nicat vardır.** (Şərab barəsində nazil olan 4 ayənin axırıncısı bu ayədir. Şərab barəsində nazil olan 4 ayənin xüsusiyyəti Bəqərə surəsinin 216-cı ayəsindən əvvəl qeyd olundu. Növbəti ayədə yenə şərab və qumarı tərk etməyi təkidlə buyurur).

**91) (إِنَّمَا يُرِيدُ الشَّيْطَانُ أَنْ يُوقِعَ بَيْنَكُمُ الْعَدَاوَةَ وَالْبَغْضَاءَ فِي الْخَمْرِ وَالْمَيْسِرِ) – çünki bu qeyd olunan şeylər şeytan əməlidir,** (hər bir pis əməl şeytana isnad edilər)**,**

وَيَصُدَّكُمْ عَنْ ذِكْرِ اللّٰهِ وَعَنِ الصَّلَاةِ فَهَلْ أَنْتُمْ مُنْتَهُونَ ﴿٩١﴾ وَأَطِيعُوا اللّٰهَ وَأَطِيعُوا الرَّسُولَ
وَاحْذَرُوا فَإِنْ تَوَلَّيْتُمْ فَاعْلَمُوا أَنَّمَا عَلَى رَسُولِنَا الْبَلَاغُ الْمُبِينُ ﴿٩٢﴾ لَيْسَ عَلَى الَّذِينَ آمَنُوا
وَعَمِلُوا الصَّالِحَاتِ جُنَاحٌ فِيمَا طَعِمُوا إِذَا مَا اتَّقَوْا وَآمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ ثُمَّ اتَّقَوْا وَآمَنُوا ثُمَّ
اتَّقَوْا وَأَحْسَنُوا وَاللّٰهُ يُحِبُّ الْمُحْسِنِينَ ﴿٩٣﴾

---

**şeytanın istəyi odur ki, şərab və qumar vasitəsilə sizin aranıza ədavət və düşmənçilik salsın.** (Nadir hallarda şərab və qumarbazların arasında mübahisə və dava olmaz). **(وَيَصُدَّكُمْ عَنْ ذِكْرِ اللّٰهِ وَعَنِ الصَّلَاةِ) – yenə şeytanın istəyi odur ki, sizi şərab və qumarla məşğul edib, Allah-Təalanı zikr etməkdən, namaz qılmaqdan ayırsın. (hansı əyyaş və qumarbaz Allah-Təalanı zikr edib namaz qılar? Şərab və qumar Allah-Təalanın zikrinə böyük maneədir). (فَهَلْ أَنْتُمْ مُنْتَهُونَ)** – (şərab və qumar haqda bu qədər pis xüsusiyyətlər ki, qeyd olundu), bəs yenə onları tərk etməzsiniz? (Bir şeyin ki pisliyi və qəbahəti məlum oldu, insan gərək onu tərk etsin. Şərab və qumardan pis və qəbih şey olmaz. Bəs niyə onları tərk etmirsiniz?)

**92) (وَأَطِيعُوا اللّٰهَ وَأَطِيعُوا الرَّسُولَ وَاحْذَرُوا) – Allah-Təalaya və onun peyğəmbərinə** (Hz. Məhəmmədə) **itaət edin. Allah-Təalanın əzabından qorxub, (haram olan şeylərə, xüsusən, şərab və qumara qurşanmayın). (فَإِنْ تَوَلَّيْتُمْ)** – **əgər üz döndərib** (Allah-Təalanın əmr və qadağalarına əməl etməsəniz), **(فَاعْلَمُوا أَنَّمَا عَلَى رَسُولِنَا الْبَلَاغُ الْمُبِينُ) – o vaxt bilin ki, peyğəmbərə heç bir zərər yoxdur.** (Əgər bir zərər olsa, sizin özünüzə yetişəcəkdir. Həqiqətən, bizim peyğəmbərə lazım olan şey hər bir hökmü sizə açıq-aşkar yetirməkdir).

**93) (لَيْسَ عَلَى الَّذِينَ آمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جُنَاحٌ فِيمَا طَعِمُوا) – iman gətirib, saleh əməl edən şəxslərə halal şeylərdən hər bir növ ləzzətli yeməkləri yeməkdə heç bir günah yoxdur. (إِذَا مَا اتَّقَوْا وَآمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) – nə zaman ki Allah-Təaladan qorxub, haram yeməyi tərk edib, imanlarında sabit olub saleh əməl etsələr, (ثُمَّ اتَّقَوْا وَآمَنُوا) – ondan sonra yenə çəkinib, imanlarında möhkəm və sabit olsalar, (ثُمَّ اتَّقَوْا وَأَحْسَنُوا) – ondan sonra təqvalarında sabit olub xalqa ehsan etsələr, (وَاللّٰهُ يُحِبُّ الْمُحْسِنِينَ) – Allah-Təala ehsan edən şəxsləri – hansı ki ümmətin övladları yolunda mallarını sərf edərlər, onları sevər.** (Qeyd olunan bu xüsusiyyətlərə sahib olan şəxs dünyada nə qədər ləzzətli yeməklərdən yesə də, ondan ötrü heç bir günah olmaz. Allah-Təala müxtəlif nemətlərini bəndələrindən ötrü yaradıbdır. Amma elə ki bir şəxs harama yönəldi, Allah-Təaladan uzaqlaşdı, o yediyi yemək ondan ötrü günah və əzab olar. Sıradakı ayə Hüdeybiyyə ilində nazil olubdur. Hüdeybiyyə Məkkənin yaxınlığında bir yerin adıdır. O il Hz. Peyğəmbər ümrədən ötrü Məkkəyə getdi. Hüdeybiyyəyə çatanda Məkkə əhli onun Məkkəyə daxil olmasına mane oldu. Hz. Peyğəmbər orada ehramdan çıxıb Mədinəyə qayıtdı. Bu

**يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَيَبْلُوَنَّكُمُ اللَّهُ بِشَيْءٍ مِنَ الصَّيْدِ تَنَالُهُ أَيْدِيكُمْ وَرِمَاحُكُمْ لِيَعْلَمَ اللَّهُ مَنْ يَخَافُهُ بِالْغَيْبِ فَمَنِ اعْتَدَى بَعْدَ ذَلِكَ فَلَهُ عَذَابٌ أَلِيمٌ ﴿٩٤﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَقْتُلُوا الصَّيْدَ وَأَنْتُمْ حُرُمٌ وَمَنْ قَتَلَهُ مِنْكُمْ مُتَعَمِّدًا فَجَزَاءٌ مِثْلُ مَا قَتَلَ مِنَ النَّعَمِ يَحْكُمُ بِهِ ذَوَا عَدْلٍ مِنْكُمْ هَدْيًا بَالِغَ الْكَعْبَةِ أَوْ كَفَّارَةٌ طَعَامُ مَسَاكِينَ أَوْ عَدْلُ ذَلِكَ صِيَامًا لِيَذُوقَ وَبَالَ أَمْرِهِ عَفَا اللَّهُ عَمَّا سَلَفَ**

---

əhvalat Məkkə fəthindən qabaq olub. Hz. Peyğəmbər səhabələrlə birlikdə Hüdeybiyyəyə çatanda orada çox vəhşi heyvanlar zahir oldu. Səhabələr istədilər ki, onları ovlasınlar, sıradakı ayə və ondan sonra gələn ayələr ehram halətində ov etməyin haram olması barəsində nazil oldu. Bu hökm bütün müsəlmanlara şamildir. Gərək, hər bir zaman buna əməl edilsin).

**94) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirən şəxslər, (لَيَبْلُوَنَّكُمُ اللَّهُ بِشَيْءٍ مِنَ الصَّيْدِ تَنَالُهُ أَيْدِيكُمْ وَرِمَاحُكُمْ) – Allah-Təala əllərinizin, ya da nizələrinizin çata biləcəyi ov heyvanları ilə sizi imtahan edir ki, görsün onları ovlayırsınız, yoxsa yox? Halbuki ehramdasınız, ehramda ovlamaq haramdır. (لِيَعْلَمَ اللَّهُ مَنْ يَخَافُهُ بِالْغَيْبِ) – Allah-Təala sizi ehram halınızda imtahan edir ki, Allah-Təalanın axirət əzabını görmədən qorxub haram heyvanları ovlamayan şəxslə Allah-Təalanın qəzəbindən qorxmayıb o heyvanları ovlayanı ayırd etsin. (فَمَنِ اعْتَدَى بَعْدَ ذَلِكَ فَلَهُ عَذَابٌ أَلِيمٌ) – kim Allah-Təalanın qoyduğu həddi aşıb ehram halında ov etsə, ondan ötrü axirətdə şiddətli əzab vardır.**

**95) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirən şəxslər, (لَا تَقْتُلُوا الصَّيْدَ وَأَنْتُمْ حُرُمٌ) – Məkkəyə gedib ehramda olan halda ovu öldürməyin. (وَمَنْ قَتَلَهُ مِنْكُمْ مُتَعَمِّدًا) – kim qəsdən ov edib öldürsə,** (yəni ehram halında ovun haram olduğunu bildiyi halda), **(فَجَزَاءٌ مِثْلُ مَا قَتَلَ مِنَ النَّعَمِ) – ehram halında ov edib heyvanı öldürənin cəzası odur ki, (dəvədən, öküzdən, qoyundan, keçidən, ya da bunların balalarından, hansı ki ovlanan heyvanın mislidir), gərək, onun əvəzində kəffarə versin. (يَحْكُمُ بِهِ ذَوَا عَدْلٍ مِنْكُمْ) – o heyvanlardan ovun mislinin nə olduğuna içinizdən iki nəfər adil şəxs hökm edər ki, öldürülən heyvanın mislinin dəvə, öküz, yoxsa başqa heyvan olduğu məlum olsun,** (onun misli məlum olandan sonra o kəffarənin hara sərf olunması gərəkdiyi də sıradakı ayədə göstərilir:) **(هَدْيًا بَالِغَ الْكَعْبَةِ) – kəffarə olan heyvan Kəbədən ötrü töhfədir. Gərək onu hərəmdə, ya da Kəbənin ətrafında** (Məkkə şəhərində) **kəsib, yoxsullara paylamaq lazımdır. (أَوْ كَفَّارَةٌ طَعَامُ مَسَاكِينَ) – ya da o ovun kəffarəsi odur ki, onun əvəzində kəsilən heyvanın qiyməti qədər yoxsullara yemək versin. (أَوْ عَدْلُ ذَلِكَ صِيَامًا) – ya da o yeməyin müqabilində kəffarədən ötrü oruc tutsun, hər iki *"müd" (1, 630 kg) yeməyin müqabilində bir gün oruc tutmaq lazımdır, ov edən şəxs bu 3 kəffarədən birini seçməkdə azaddır. Hansını seçsə, caizdir). (لِيَذُوقَ وَبَالَ أَمْرِهِ) – bu kəffarəni gərək versin ki, öz etdiyi əməlin zərərini dadsın. (عَفَا اللَّهُ عَمَّا سَلَفَ) – bu hökmdən qabaq ov-**

وَمَنْ عَادَ فَيَنْتَقِمُ اللّٰهُ مِنْهُ وَاللّٰهُ عَزِيزٌ ذُو انْتِقَام ﴿٩٥﴾ أُحِلَّ لَكُمْ صَيْدُ الْبَحْرِ وَطَعَامُهُ مَتَاعًا لَكُمْ
وَلِلسَّيَّارَةِ وَحُرِّمَ عَلَيْكُمْ صَيْدُ الْبَرِّ مَا دُمْتُمْ حُرُمًا وَاتَّقُوا اللّٰهَ الَّذِي إِلَيْهِ تُحْشَرُونَ ﴿٩٦﴾ جَعَلَ اللّٰهُ
الْكَعْبَةَ الْبَيْتَ الْحَرَامَ قِيَامًا لِلنَّاسِ

---

**ladıqlarınızın günahlarını Allah-Təala sizə bağışladı. (وَمَنْ عَادَ فَيَنْتَقِمُ اللّٰهُ مِنْهُ) – kim bu hökmlərdən sonra yenidən dönüb ehramda ikən heyvan ovlasa, Allah-Təala ondan intiqam alar. (وَاللّٰهُ عَزِيزٌ ذُو انْتِقَامٍ) – Allah-Təala məxluqata qalibdir və intiqam almağa qadirdir.**

*(*Qeyd: Müd bu dövrdə iki kirvəngədir).*

**96) (أُحِلَّ لَكُمْ صَيْدُ الْبَحْرِ وَطَعَامُهُ مَتَاعًا لَكُمْ وَلِلسَّيَّارَةِ) – ehram halətində ikən Məkkənin ətrafında sizə və ya uzaqdan gələn müsafirlərə dəniz ovu halal edildi. (dəniz ovunun halal olmasının hikməti odur ki, birdən başqa qida tapılmasa, o vaxt dəniz ovu ilə dolansınlar). (وَحُرِّمَ عَلَيْكُمْ صَيْدُ الْبَرِّ مَا دُمْتُمْ حُرُمًا) – amma nə qədər ki ehramdasınız, çöldə olan ov heyvanları sizə haram edildi, ehramdan çıxdıqdan sonra halaldır. (وَاتَّقُوا اللّٰهَ الَّذِي إِلَيْهِ تُحْشَرُونَ) – hamınız axirətdə yanında toplanacağınız Allah-Təaladan qorxub haram olan şeyləri halal etməyin.**

**97) (جَعَلَ اللّٰهُ الْكَعْبَةَ الْبَيْتَ الْحَرَامَ قِيَامًا لِلنَّاسِ) – Allah-Təala ehtiramlı olan evi - Kəbəni* insanların dünya və axirət işlərinin islahından ötrü müəyyənləşdirdi. Belə ki, hər bir tərəfdən insanlar orada toplanıb, dünya və axirət işlərini orada islah etsinlər.** (Amma Kəbə ziyarətinə gedən müsəlmanlar dünya işlərini islah etmənin vacibliyindən tam bixəbərdirlər)**.**

*(*Qeyd: Allah-Təalanın həcci əmr etməsində hikmət odur ki, müsəlmanlar bir vaxtda zülhiccə ayında Məkkədə toplansınlar. Orada qurbanlar kəsib,yoxsulları yedirsinlər, çünki yemək veriləndə xalq da ora çox toplanar. Necə ki indi də o ətrafda olan minlərlə ərəblər məhz heyvanatın ətindən ötrü orada toplanıb, o ətləri günün istisində qurudub aparıb onunla qidalanırlar. Heyvan kəsməkdə çox fayda var, məsələn, elə ki müsəlmanlar bir yerə toplandılar, din və dünya işləri ilə əlaqəli məşvərət edib, nəticəsi nə olsa, ona əməl edərlər. Bu mətləbə indi yavaş-yavaş bəzi maarifpərvər müsəlmanlar agah olurlar. Bu ayənin məzmunu bu vaxta qədər qaranlıq qalıbdır. Müsəlmanlar Qurani-Şərifdə belə bir ayənin olmasına heç diqqət etməyiblər ki, həccə getməyin faydasını da dərk etsinlər. Bu zamana kimi hər il minlərlə müsəlman həccə toplanır, lakin heç bir fayda əldə edə bilməyiblər. İslam ümməti bəsirət gözlərini açıb Qurani-Şərifin ayələrinə fikir versinlər, hər bir ayənin ehtivasında neçə siyasi məna var. Amma heç biri siyasət məsələsində həccə çata bilməz.. Amma nə fayda ki, müsəlmanların həccə gedib-gəlməsi tamamilə şüursuz və kor-koranə olubdur. Bu əzəmətli əmrdən heç bir fayda əldə etmirlər. Nə gözəl deyir Mövlana Cəlaləddin Rumi : Özünüzə gəlin də bəla çölünə kor-koranə getməyi. Özünüzə gəlin də kor koranə Kərbalaya at sürməyin. Qurani-Şərifdə olan incəlikləri, gərək, alimlər xalqa bildirsinlər. Bəs alimlər bu ayənin mənasına diqqət edib xalqa*

وَالشَّهْرَ الْحَرَامَ وَالْهَدْيَ وَالْقَلاَئِدَ ذَلِكَ لِتَعْلَمُوا أَنَّ اللَّهَ يَعْلَمُ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ وَأَنَّ
اللَّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿٩٧﴾ اعْلَمُوا أَنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ وَأَنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ ﴿٩٨﴾ مَا عَلَى
الرَّسُولِ إِلَّا الْبَلَاغُ وَاللَّهُ يَعْلَمُ مَا تُبْدُونَ وَمَا تَكْتُمُونَ ﴿٩٩﴾ قُلْ لَا يَسْتَوِي الْخَبِيثُ وَالطَّيِّبُ وَلَوْ
أَعْجَبَكَ كَثْرَةُ الْخَبِيثِ فَاتَّقُوا اللَّهَ يَا أُولِي الْأَلْبَابِ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿١٠٠﴾

---

*elan və bəyan ediblərmi? Əgər belə şəxs olsa da, ona küfr və zındıqlıq isnad edirlər. Özlərini alim kimi göstərənlərə ayənin mənası ilə əlaqəli belə söz deyəndə, sanki qarınlarına od doldurursan. Cəhalət odu onların sinələrində alovlanıb, həccin faydası axirətdə huriləri qucaqlayıb onlarla gündə 100 min dəfə əlaqədə olmaqdan ibarətdir, deyib sözü bitirirlər).*

(وَالشَّهْرَ الْحَرَامَ وَالْهَدْيَ وَالْقَلَائِدَ) – **Allah-Təala sizdən ötrü hörmətli** (haram) **ay** (həcc ayı zilhiccə) **və o ayda qurbanlıq, xüsusən, nişanlı qurbanlıqlar təyin etdi,** (nişanlı qurbanın əhvalatı əvvəldə Bəqərə surəsində qeyd olundu), **bunların hamısını Allah-Təala müəyyənləşdiribdir. Belə ki, xalq orada toplanıb, din və dünya işlərini islah etsinlər.** (ذَلِكَ) – **bu Kəbənin sizdən ötrü məsləhət yeri təyin edilməsinin səbəbi odur ki,** (لِتَعْلَمُوا أَنَّ اللَّهَ يَعْلَمُ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ) – **biləsiniz ki, həqiqətən, Allah-Təala səmalarda və yerdə olan şeylərə və sizin işlərinizdən agahdır, bilir ki, sizdən ötrü nə cür hökmlər qərar versin və sizin xeyrinizə uyğun olsun. Amma heyif ki, siz bu mətləbi dərk etməyib Allah-Təalanın məsləhətini qoyub nəfsani arzulara tabe olursunuz.** (وَأَنَّ اللَّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) – **həqiqətən, Allah-Təala hər bir şeydən agahdır, sizdən ötrü verdiyi hökmlər və qanunlar tamamən elm üzrə müəyyənləşdirilibdir.**

**98)** (اعْلَمُوا أَنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ) – (bütün insanlara xitabdır)**, bilin ki, həqiqətən, Allah-Təala asi olan şəxslərə şiddətli əzab edəndir.** (وَأَنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ) – **və həqiqətən, Allah-Təala tövbə edib onun tərəfinə qayıdanları bağışlayıb rəhm edəndir.**

**99)** (مَا عَلَى الرَّسُولِ إِلَّا الْبَلَاغُ) – **bizim bu peyğəmbərimizə** (Hz. Məhəmmədə) **bizim hökmlərimizi sizə yetirməkdən başqa heç bir şey lazım deyil, sizə lazımdır ki, Allah-Təalanın əmr və qadağalarına və məsləhətinə əməl edəsiniz.** (وَاللَّهُ يَعْلَمُ مَا تُبْدُونَ وَمَا تَكْتُمُونَ) – **Allah-Təala aşkar etdiyiniz və gizlətdiyiniz hər bir əməldən agahdır. Zahir və batininizi bilir.**

**100)** (قُلْ لَا يَسْتَوِي الْخَبِيثُ وَالطَّيِّبُ) – (ey Məhəmməd)**, xalqa de ki, heç vaxt nəcis və murdar olan şeylə pak olan şey Allah-Təala yanında bərabər olmaz. (halal haramla, mömin fasiqlə, yaxşı pislə, alim cahillə bərabər olmaz),** (وَلَوْ أَعْجَبَكَ كَثْرَةُ الْخَبِيثِ) – **ey insan, hərçənd xəbislərin, cahillərin çox olması səni təəccübləndirir, amma onlar Allah-Təala yanında heç bir şey deyil.** (فَاتَّقُوا اللَّهَ يَا أُولِي الْأَلْبَابِ) – **ey ağıl sahibləri, Allah-Təaladan qorxub xəbis və cahillərdən uzaq olun.** (لَعَلَّكُمْ تُفْلِحُونَ) – **əlbəttə, cəhalətdən çəkinməklə**

**يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَسْأَلُوا عَنْ أَشْيَاءَ إِنْ تُبْدَ لَكُمْ تَسُؤْكُمْ وَإِنْ تَسْأَلُوا عَنْهَا حِينَ يُنَزَّلُ الْقُرْآنُ تُبْدَ لَكُمْ عَفَا اللَّهُ عَنْهَا وَاللَّهُ غَفُورٌ حَلِيمٌ ﴿١٠١﴾ قَدْ سَأَلَهَا قَوْمٌ مِنْ قَبْلِكُمْ ثُمَّ أَصْبَحُوا بِهَا كَافِرِينَ ﴿١٠٢﴾**

---

**nicat taparsınız.** (Bu ayənin məzmununa bu zəmanədə fikir verib diqqət etmək lazımdır, müsəlmanları cəhalət bürüyüb, özgə xalqların arasında elm və mədəniyyət rəvac tapdıqca islam ümməti arasında günbəgün cəhalət rəvac tapır. Səbəbi nədir? **"Əz mast ke bər mast"** / Özümüz özümüzə edirik. Başa düş.)

**101) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَسْأَلُوا عَنْ أَشْيَاءَ) – ey iman gətirənlər, Hz. Peyğəmbərdən bəzi şeyləri soruşmayın, (إِنْ تُبْدَ لَكُمْ تَسُؤْكُمْ) – əgər o şeylərin həqiqətini sizdən ötrü bəyan etsə, o vaxt siz qəmgin olub sual verməyinizə peşman olarsınız, (وَإِنْ تَسْأَلُوا عَنْهَا حِينَ يُنَزَّلُ الْقُرْآنُ تُبْدَ لَكُمْ) – və nə qədər ki, Hz. Peyğəmbər sizin aranızdadır və Quran nazil olur, əgər sual versəniz, o vaxt o şeylərin həqiqətini sizdən ötrü bəyan edəcəkdir. Amma siz ondan qəmgin olub məhzun olacaqsınız. Yaxşı olar ki, belə sualları tərk edəsiniz. (عَفَا اللَّهُ عَنْهَا) – Allah-Təala bundan qabaq verdiyiniz sualları sizə bağışladı. Bundan sonra daha boş-boş suallar verməyin. (وَاللَّهُ غَفُورٌ حَلِيمٌ) – Allah-Təala sizi əməllərinizə görə bağışlayıb, sizə əzab etməkdə tələsən deyil.** (Şeyx Təbrəsi "Məcməül-bəyan" əsərində rəvayət edir: "O zaman ki Hz. Peyğəmbərə çox sual verdilər, o həzrət qəzəblənib durdu, minbərdə buyurdu ki, istədiyinizi soruşun, xəbər verəcəyəm". Abdullah ibn Xuzafə öz soyuna tənə və şübhə edildiyi üçün ayağa durub dedi: "Ey Peyğəmbər, mənim atam kimdir?" Həzrət buyurdu: "Sənin atan Xuzafədir". Başqa bir şəxs ayağa durub dedi: "Ey Peyğəmbər, mənim atam haradadır?" Həzrət buyurdu ki, "Cəhənnəmdədir". Xalq gördü ki, Hz. Peyğəmbər onların bütün eybini açıb deyəcək, Ömər ibn Xəttab ayağa durub Hz. Peyğəmbərin mübarək ayağından öpüb ərz etdi: "Ey Peyğəmbər, şirk və cahiliyyədən təzəliklə islama keçmişik, islamın qanunlarına yaxşı bələd deyilik, əfv et bizi". Hz. Peyğəmbər də "Allah-Təala səni əfv etsin" - deyib, sakitləşdi, xalq da boş-boş suallar verməkdən əl çəkdi (Təbərsi, Məcməul-Bəyan, III/386; Buxari, Tefsiru Sure, 5/12; Müslüm, Fəzail, 134-138)).

**102) (قَدْ سَأَلَهَا قَوْمٌ مِنْ قَبْلِكُمْ) – ey möminlər, həqiqətən, sizdən qabaq bəni-İsrail camaatı da sizin kimi peyğəmbərlərinə məşəqqətli suallar verirdilər, (ثُمَّ أَصْبَحُوا بِهَا كَافِرِينَ) – vəzifələri onlardan ötrü bəyan edəndən sonra dönüb o təklifləri inkar etdilər, halbuki gərək, itaət edəydilər.** (Sizdən ötrü də əgər Hz. Məhəmməd vəzifələrinizi bəyan etsə, qəbul etməyib kafir olarsınız. Belə təqdirdə o sualları tərk etməyiniz yaxşıdır. Cahiliyyə zamanında ərəblərin arasında bir neçə adət var idi. 1- əgər bir dəvə 5 ədəd bala doğub 5-ci balası erkək olsaydı, o dəvənin qulağını yarıb işləməkdən və minilməkdən onu azad edərdilər və onun adına "bəhirə" deyərdilər. 2- bir şəxs naxoş olanda, ya da

مَا جَعَلَ اللّٰهُ مِنْ بَحِيرَةٍ وَلَا سَائِبَةٍ وَلَا وَصِيلَةٍ وَلَا حَامٍ وَلَكِنَّ الَّذِينَ كَفَرُوا يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ
وَأَكْثَرُهُمْ لَا يَعْقِلُونَ ﴿١٠٣﴾ وَإِذَا قِيلَ لَهُمْ تَعَالَوْا إِلَى مَا أَنْزَلَ اللّٰهُ وَإِلَى الرَّسُولِ قَالُوا حَسْبُنَا مَا
وَجَدْنَا عَلَيْهِ آبَاءَنَا أَوَلَوْ كَانَ آبَاؤُهُمْ لَا يَعْلَمُونَ شَيْئًا وَلَا يَهْتَدُونَ ﴿١٠٤﴾

---

səfərdə olanda nəzir edib deyərdi: "Əgər mən naxoşluqdan şəfa tapsam, ya da səfərdən salamat qayıtsam, filan dəvəm azad olsun, necə ki bəhirəni azad edirdilər". O dəvənin adına "saibə" deyərdilər. 3- əgər qoyunları dişi doğsaydı, deyərdilər: "Bu, bizimdir," əgər erkək doğsaydı, deyərdilər: "Bu, bizim bütlərdən ötrü qurbanlıqdır". Onu bütlərin qabağında qurban edərdilər və əgər biri erkək, biri dişi iki bala doğsaydı, o vaxt deyərdilər: "Bu erkək bacısına yapışıbdır. Bu da bizimdir". Onu bütlərdən ötrü qurban etməzdilər. onun adına "vəsilə" deyərdilər. 4- əgər bir erkək dəvədən 10 bala əmələ gəlsəydi, ondan sonra o dəvəni daha işlətməyib, hər bir əməldən azad edib, onun adına "ham" deyərdilər (Buxari, Mənaqib 9, Müslüm, Cənnət 51). Bu əməlləri Allah-Təalaya isnad verib deyərdilər: "Bunları Allah-Təala təyin edibdir". Allah-Təala onların sözünün inkarı haqqında gələn ayəni nazil buyurdu).

**103) * (مَا جَعَلَ اللّٰهُ مِنْ بَحِيرَةٍ وَلَا سَائِبَةٍ وَلَا وَصِيلَةٍ وَلَا حَامٍ) - nə bəhirə, nə saibə, nə vəsilə, nə ham, bunların heç birini Allah-Təala təyin etməyib. (وَلَكِنَّ الَّذِينَ كَفَرُوا يَفْتَرُونَ عَلَى اللّٰهِ الْكَذِبَ) – amma kafir olan şəxslər** (müşriklər) **Allah-Təalaya iftira edib yalan uydururlar. (وَأَكْثَرُهُمْ لَا يَعْقِلُونَ) – müşriklərin çoxu ağılla hərəkət etməyib, böyüklərinə tabe olub belə sözlərlə Allah-Təalaya iftira atırlar.**

*(*Qeyd:* **İslamda** *biz müsəlmanların arasında bunlardan da betər şeylər var. Allah-Təalaya isnad edib, bəzi şeyləri özümüzdən ötrü Allah-Təalaya yaxınlaşma vasitəsi sayırıq. Filan imamzadəyə, ya filan pirə, ya filan ocağa, ya filan daşa, ya filan müqəddəsin qədəmgahına - ayaq izinə qurban aparıb, pak olan heyvanı kəsib ətini haram etmək cahiliyyə zamanından betər əməldir. Ar olsun islam ümmətinə, adlarını müsəlmanlar qoyub, amma bütpərəstlərə qoşulurlar. Müsəlmanların alimləri bu əməllərə qoşulanda, avamlara nə irad tutaq?)*

**104) (وَإِذَا قِيلَ لَهُمْ تَعَالَوْا إِلَى مَا أَنْزَلَ اللّٰهُ وَإِلَى الرَّسُولِ) – möminlər müşriklərə deyəndə ki, Allah-Təala göndərən Qurana və onun peyğəmbərinə tərəf gəlin ki, ilahi ehkamı sizdən ötrü bəyan etsin, (قَالُوا حَسْبُنَا مَا وَجَدْنَا عَلَيْهِ آبَاءَنَا) – müşriklər cavabında dedilər:* "Ata-babalarımızın olduğu din bizə kifayət edər. Ondan başqa din və məzhəb bizə lazım deyildir". (أَوَلَوْ كَانَ آبَاؤُهُمْ لَا يَعْلَمُونَ شَيْئًا وَلَا يَهْتَدُونَ) – o şəxs ata-babaya tabe olar ki, ata-babası alim olub dəlil və sübut üzrə söz deyər, bəs bu müşriklərin ata-babaları hərçənd heç bir şey bilməyib və hidayətdə olmayıbdır, yenə onlara tabe olurlar, ağıllı şəxs heç belə ata-babaya tabe olarmı?**

**يَا أَيُّهَا الَّذِينَ آمَنُوا عَلَيْكُمْ أَنْفُسَكُمْ لَا يَضُرُّكُمْ مَنْ ضَلَّ إِذَا اهْتَدَيْتُمْ إِلَى اللهِ مَرْجِعُكُمْ جَمِيعًا فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿١٠٥﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا شَهَادَةُ بَيْنِكُمْ إِذَا حَضَرَ أَحَدَكُمُ الْمَوْتُ حِينَ الْوَصِيَّةِ اثْنَانِ ذَوَا عَدْلٍ مِنْكُمْ أَوْ آخَرَانِ مِنْ غَيْرِكُمْ إِنْ أَنْتُمْ ضَرَبْتُمْ فِي الْأَرْضِ فَأَصَابَتْكُمْ مُصِيبَةُ الْمَوْتِ تَحْبِسُونَهُمَا مِنْ بَعْدِ الصَّلَاةِ فَيُقْسِمَانِ بِاللهِ إِنِ ارْتَبْتُمْ لَا نَشْتَرِي بِهِ ثَمَنًا وَلَوْ كَانَ ذَا قُرْبَى**

---

*(*Qeyd:* *Əgər bu zamanda müsəlmanlara desən ki, filan əməl islamda yoxdur, bidət və zəlalətdir, cavabında deyərlər: "Ata-babalarımızdan həmişə belə görmüşük," - əgər diqqətlə baxsan, əhli-islamın çoxunu islam təriqəsi içində şirkdə görərsən).*

**105) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirənlər, (عَلَيْكُمْ أَنْفُسَكُمْ) – siz özünüzü Allah-Təalaya asi olmaqdan saxlayıb özgə şəxslərin fikrini çəkməyin,** (möminlər həsrət çəkirdilər ki, niyə müşriklər hidayət tapmayıb zəlalətdə qalıblar? Allah-Təala möminlərə buyurur: siz onların fikirlərini çəkməyin. Siz öz vəzifələrinizə əməl edin), **(لَا يَضُرُّكُمْ مَنْ ضَلَّ إِذَا اهْتَدَيْتُمْ) – əgər siz hidayətdə olsanız, zəlalətdə olan şəxslər sizə zərər yetirməzlər.** (Bu ayə xeyri əmr edən şəxslərə xitabdır, yəni səndən qəbul etməsələr də, sənə bir zərər gəlməz. Sən öz əməlində ol. Onları Allah-Təalaya həvalə elə). **(إِلَى اللهِ مَرْجِعُكُمْ جَمِيعًا) – siz möminlərin və zəlalətdə olanların hamınızın qayıdacağı yer Allah-Təala tərəfinədir. (فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) – dünyada etdiyiniz əməllərinizi sizə qiyamət günündə xəbər verib, hər şəxsin öz əməlinin qarşılığı özünə yetişəcəkdir.**

**106) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا شَهَادَةُ بَيْنِكُمْ إِذَا حَضَرَ أَحَدَكُمُ الْمَوْتُ حِينَ الْوَصِيَّةِ اثْنَانِ) – ey iman gətirənlər, nə zaman sizlərdən birini ölüm haqlasa, o vaxt sizə lazımdır ki, vəsiyyət edəsiniz, o vəsiyyətdə sizin aranızda iki nəfər şahid gərək olsun. (ذَوَا عَدْلٍ مِنْكُمْ أَوْ آخَرَانِ مِنْ غَيْرِكُمْ) – Siz vəsiyyət edənlərin qohum-əqrəbasından, ya da başqa şəxslərdən olan o iki nəfər şahid, gərək, adil olsunlar. (إِنْ أَنْتُمْ ضَرَبْتُمْ فِي الْأَرْضِ فَأَصَابَتْكُمْ مُصِيبَةُ الْمَوْتِ) – vəsiyyətə hər zaman şahid tutmaq lazımdır, xüsusən, müsafirlikdə olsanız, səfərdə ölüm müsibətinə düçar olsanız, iki nəfər şahid hüzurunda vəsiyyət edin, (şahidlər səfərdən qayıdıb, vəfat edən şəxsin malını gətirib varisinə verəndə, əgər varisin onların haqqında şübhəsi olsa, o şahidlərə and içdırərlər. Bundan sonra gələn ayə varislərə xitabdır). (تَحْبِسُونَهُمَا مِنْ بَعْدِ الصَّلَاةِ) – siz varislər o şahidlərə bu şəkildə and içdirin: onları tutub əsr namazından sonra saxlayın. (فَيُقْسِمَانِ بِاللهِ إِنِ ارْتَبْتُمْ) – əgər onlara şübhəniz olsa, o şahidlər dedikləri sözlərinin doğruluğundan ötrü Allah-Təalaya and içərlər, (əgər şübhə yoxdursa, and içdirmək olmaz). (لَا نَشْتَرِي بِهِ ثَمَنًا وَلَوْ كَانَ ذَا قُرْبَى) – and içəndə belə deyərlər: "Biz and içirik Allah-Təalaya ki, sözümüzdə sadiqik və dünya malını alıb yalandan and içmərik. Hərçənd bizə yaxın qohum da olsa, heç vaxt**

وَلَا نَكْتُمُ شَهَادَةَ اللهِ إِنَّا إِذًا لَمِنَ الْآثِمِينَ ﴿١٠٦﴾ فَإِنْ عُثِرَ عَلَى أَنَّهُمَا اسْتَحَقَّا إِثْمًا فَآخَرَانِ يَقُومَانِ
مَقَامَهُمَا مِنَ الَّذِينَ اسْتَحَقَّ عَلَيْهِمُ الْأَوْلَيَانِ فَيُقْسِمَانِ بِاللهِ لَشَهَادَتُنَا أَحَقُّ مِنْ شَهَادَتِهِمَا وَمَا اعْتَدَيْنَا
إِنَّا إِذًا لَمِنَ الظَّالِمِينَ ﴿١٠٧﴾ ذَلِكَ أَدْنَى أَنْ يَأْتُوا بِالشَّهَادَةِ عَلَى وَجْهِهَا

---

**tərəfgirlik edib, yalandan and içmərik.** (وَلَا نَكْتُمُ شَهَادَةَ اللهِ إِنَّا إِذًا لَمِنَ الْآثِمِينَ) – **Allah-Təalanın əmr etdiyi şahidliyi gizlətmərik, əgər şahidliyi gizlədib, yalan şahidlik etsək, əlbəttə, həqiqətən, o vaxt biz günahkarlardan olarıq".** (Şahidlikdə bu sözləri deyib şahidlik edərlər. Bu sözləri demək ancaq bu şahidliyə məxsus deyil. Bəlkə, hər bir şahidlikdə bu sözləri demək lazımdır).

**107)** (فَإِنْ عُثِرَ عَلَى أَنَّهُمَا اسْتَحَقَّا إِثْمًا) – **əgər kənardan belə məlum olsa ki, şahidlər günah qazanıb,* yalan şahidlik ediblər,**

*(***Qeyd:*** Büdeyl ibn Əbi Məryəm (Əmr ibnül-Asın qulamı)* ***i****ki nəfər xristian dostu ilə Şama ticarətə getdi. Dostunun biri Adi ibn Zeyd, o birisi Təmim ibn Evs idi. Büdeyl Şamda naxoş oldu. Bir kağız yazıb libaslarının arasına qoydu. Dostlarına dedi: "Əgər ölsəm, mənim qalan şeylərimi Mədinəyə aparıb mənim ailəmə verin". Büdeyl vəfat etdi. O iki xristian onun şeylərini axtardılar. Qızılla naxışlanmış gümüş bir qab tapdılar. İçindəki 300 misqal gümüş sikkəni götürdülər. Kağızı görmədilər. Gəldilər Mədinəyə, onun qalan şeylərini ailəsinə verdilər. Onlar o kağızı tapıb gəldilər, o xristianlardan o qabı və pulu istədilər. Onlar inkar etdilər. Onları Hz. Peyğəmbərin hüzuruna gətirdilər. Ayə nazil oldu. Onlar and içdilər ki, bu qab bizimdir. Bir Əmr ibnül-As , bir də Büdeylin adamlarından Mətləb ibn Əbi Dari and içdilər ki, bunlar yalan deyirlər. O qabı və pulu aldılar) .*

(فَآخَرَانِ يَقُومَانِ مَقَامَهُمَا) – **o vaxt başqa iki nəfər şahid onların yerinə durub onların yalan şahidlik etdiklərinə şahidlik edərlər. "Əvvəlki şahidlərin şahidliyinin yalan olması şahidsiz qəbul olunmaz",** (مِنَ الَّذِينَ اسْتَحَقَّ عَلَيْهِمُ الْأَوْلَيَانِ) – **sonrakı iki nəfər şahidlər o şəxslərdən olar ki, əvvəlki şahidlər günahı onların haqqında edib yalan şahidlik edərlər. Bu axırdakı şahidlər qohum olduqlarına görə, başqa şəxslərdən şahidlik etməyə daha layiqdirlər. (Yəni bu axırdakı şahidlər varislərdən olar, nə vaxt o şahidlərin xəyanəti məlum olsa, o varislərdən iki nəfər şahidlik edib and içərlər ki, bu şahidlər yalan deyirlər).** (فَيُقْسِمَانِ بِاللهِ) – **varislərdən iki nəfər şahid əvvəlki şahidlərin yalan dedikləri haqqında and içib ondan sonra belə deyərdilər:** (لَشَهَادَتُنَا أَحَقُّ مِنْ شَهَادَتِهِمَا) **"Əlbəttə, bizim şahidliyimiz onların şahidliyindən daha çox qəbul olunmağa layiqdir.** (وَمَا اعْتَدَيْنَا) – **biz bu şahidliyimizdə həddi aşıb, yalandan şahidlik etmərik.** (إِنَّا إِذًا لَمِنَ الظَّالِمِينَ) – **həqiqətən, biz belə olarsa, əlbəttə, zalımlardan olarıq".**

**108)** (ذَلِكَ) – **bu varislərin şahidlərin xəyanətinə şahidlik edib, and içmələri,** (أَدْنَى أَنْ يَأْتُوا بِالشَّهَادَةِ عَلَى وَجْهِهَا) – **vəsiyyətə şahid olanların varislərin**

أَوْ يَخَافُوا أَنْ تُرَدَّ أَيْمَانٌ بَعْدَ أَيْمَانِهِمْ وَاتَّقُوا اللهَ وَاسْمَعُوا وَاللهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ ﴿١٠٨﴾
يَوْمَ يَجْمَعُ اللهُ الرُّسُلَ فَيَقُولُ مَاذَا أُجِبْتُمْ قَالُوا لَا عِلْمَ لَنَا إِنَّكَ أَنْتَ عَلَّامُ الْغُيُوبِ ﴿١٠٩﴾ إِذْ قَالَ
اللهُ يَا عِيسَى ابْنَ مَرْيَمَ اذْكُرْ نِعْمَتِي عَلَيْكَ وَعَلى وَالِدَتِكَ إِذْ أَيَّدْتُكَ بِرُوحِ الْقُدُسِ تُكَلِّمُ النَّاسَ فِي
الْمَهْدِ وَكَهْلًا وَإِذْ عَلَّمْتُكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَالتَّوْرَاةَ وَالْإِنْجِيلَ

---

**onların şahidliyinə razı olmayıb, onların xəyanətinə şahidlik etmələrindən qorxub şahidliyi olduğu kimi edib, xəyanət etməmələri üçün daha münasibdir. (**أَوْ يَخَافُوا أَنْ تُرَدَّ أَيْمَانٌ بَعْدَ أَيْمَانِهِمْ**) – ya da şahidlər bundan qorxsunlar ki, əgər yalan şahidlik etsələr, onlardan sonra başqa şahidlər and içib, onların yalanına şahidlik edərlər. O vaxt onların yalanı aşkar olub rüsvay olarlar. (**وَاتَّقُوا اللهَ وَاسْمَعُوا**) – ey şahidlər, Allah-Təaladan qorxub yalan şahidlik etməyin. Allah-Təalanın hökmlərini eşidib itaət edin. (**وَاللهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ**) – şahidliyi gizlətmək və yalan şahidlik etmək fasiqlərin əməlidir. Həqiqətən, Allah-Təala fasiq şəxsləri haqq tərəfinə hidayət etməz.**

**109) (**يَوْمَ يَجْمَعُ اللهُ الرُّسُلَ**) – qorxun o gündən ki, Allah-Təala bütün peyğəmbərləri** (qiyamət günündə) **bir yerə toplayar. (**فَيَقُولُ مَاذَا أُجِبْتُمْ**) – Allah-Təala peyğəmbərlərə buyurur: “Siz ki dünyada xalqı dəvət edib mənim hökmlərimi onlara yetirdiniz, onlar sizə nə cavab verdilər?” (**قَالُوا لَا عِلْمَ لَنَا**) – peyğəmbərlər cavabda deyərlər: “Bizim elmimiz sənin elminin yanında yox kimidir. (**إِنَّكَ أَنْتَ عَلَّامُ الْغُيُوبِ**) – həqiqətən, sənsən başqalarından agah olan, məxluqat bizə nə cavab verib, özün agahsan”.** (O vaxt Allah-Təala öz elmiylə xalq arasında hökm edər, hər bir şəxsin əməlinə görə, ona qarşılıq verər).

**110) (**إِذْ قَالَ اللهُ يَا عِيسَى ابْنَ مَرْيَمَ اذْكُرْ نِعْمَتِي عَلَيْكَ وَعَلى وَالِدَتِكَ**) – (bu ayədə Allah-Təala Hz. İsaya verdiyi nemətləri bəyan edir. Yəni İsa mənim bəndələrimdən bir bəndədir, bu nemətləri ona bəxş etmişəm. Belə bəndəyə Allah deyib mənə şərik qoşmaq layiq deyil. Ayənin mənası belədir:) o zaman ki Allah-Təala İsaya dedi: “Ey İsa Məryəm oğlu, o nemətlərimi yadına sal ki, sənin özünə və anan Məryəmə bəxş etmişəm. (**إِذْ أَيَّدْتُكَ بِرُوحِ الْقُدُسِ**) – yadına sal ki, mən sənə pak və müqəddəs olan ruhani qüvvə ilə qüvvət verdim. (**تُكَلِّمُ النَّاسَ فِي الْمَهْدِ وَكَهْلًا**) – o qüvvənin səbəbinə sən həm beşikdə uşaq olan halda və həm də kişi olduğun halda - hansı ki insanın ağlı yetkinlik zamanı kamilləşər, hər iki halda da bir fərq olmadan danışırdın. Uşaqlıq və böyüklükdə sənin danışmağında heç bir fərq yox idi.** (Bu Hz. İsaya məxsus bir möcüzədir. Ondan başqa heç bir peyğəmbər beşikdə ikən danışmayıb. 30 yaşında Hz. İsa peyğəmbərliklə vəzifələndirildi. 30 ay peyğəmbərlik edib ondan sonra Allah-Təala onu vəfat etdirib, müqəddəs ruhunu ruhlar aləminə nəql etdi). (**وَإِذْ عَلَّمْتُكَ الْكِتَابَ وَالْحِكْمَةَ وَالتَّوْرَاةَ وَالْإِنْجِيلَ**) – (ey İsa, o neməti yadına sal ki)**, yazmağı və bütün**

وَإِذْ تَخْلُقُ مِنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ بِإِذْنِي فَتَنْفُخُ فِيهَا فَتَكُونُ طَيْرًا بِإِذْنِي وَتُبْرِئُ الْأَكْمَهَ وَالْأَبْرَصَ
بِإِذْنِي وَإِذْ تُخْرِجُ الْمَوْتَى بِإِذْنِي وَإِذْ كَفَفْتُ بَنِي إِسْرَائِيلَ عَنْكَ إِذْ جِئْتَهُمْ بِالْبَيِّنَاتِ فَقَالَ الَّذِينَ كَفَرُوا
مِنْهُمْ إِنْ هَذَا إِلَّا سِحْرٌ مُبِينٌ ﴿١١٠﴾ وَإِذْ أَوْحَيْتُ إِلَى الْحَوَارِيِّينَ أَنْ آمِنُوا بِي وَبِرَسُولِي قَالُوا آمَنَّا
وَاشْهَدْ بِأَنَّنَا مُسْلِمُونَ ﴿١١١﴾ إِذْ قَالَ الْحَوَارِيُّونَ يَا عِيسَى ابْنَ مَرْيَمَ هَلْ يَسْتَطِيعُ رَبُّكَ أَنْ يُنَزِّلَ
عَلَيْنَا مَائِدَةً مِنَ السَّمَاءِ قَالَ اتَّقُوا اللَّهَ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿١١٢﴾

---

**şeylərin həqiqətini və Tövratı, İncili mən sənə öyrətdim.** (وَإِذْ تَخْلُقُ مِنَ الطِّينِ كَهَيْئَةِ الطَّيْرِ بِإِذْنِي) **- (ey İsa, yenə o neməti yadına sal ki), sən mənim iznimlə palçıqdan quş surəti kimi surət düzəltdin.** (فَتَنْفُخُ فِيهَا فَتَكُونُ طَيْرًا بِإِذْنِي) – **anadangəlmə kor və cüzam xəstələrinə mənim iznimlə şəfa verib yaxşı edirdin.** (وَتُبْرِئُ الْأَكْمَهَ وَالْأَبْرَصَ بِإِذْنِي وَإِذْ تُخْرِجُ الْمَوْتَى بِإِذْنِي) – **ölüləri mənim iznimlə qəbirdən diri çıxarırdın.** (وَإِذْ كَفَفْتُ بَنِي إِسْرَائِيلَ عَنْكَ إِذْ جِئْتَهُمْ بِالْبَيِّنَاتِ) – (yenə mənim nemətimi yadına sal), **o zaman ki sən yəhudilərə aşkar olan dəlillərlə peyğəmbər gəldin, yəhudilər qəbul etməyib istədilər ki, səni qətlə yetirsinlər. Yəhudilərin səni qətlə yetirməsindən qoruyub, nicat verdim”.** (Bu ayə buna dəlildir ki, bəni-İsrail Hz. İsanı qətlə yetirmədi). (فَقَالَ الَّذِينَ كَفَرُوا مِنْهُمْ) – **bəni-İsrailin kafir olanları dedilər:** (إِنْ هَذَا إِلَّا سِحْرٌ مُبِينٌ) – **“İsanın gətirdiyi bu şeylər ancaq açıq-aşkar sehrdir”.** (Bu möcüzələr əvvəlki Ali-İmran surəsinin 64-cü ayəsində qeyd olundu. Yenidən burada təkrarlanmasının səbəbi odur ki, Ali-İmran surəsində Allah-Təala Hz. Məryəmə Hz. İsanın doğumundan qabaq xəbər verdi ki, ey Məryəm, sənə bir oğul verəcəyəm, adı İsadır, bu möcüzələri də ona bəxş edəcəyəm. Amma bu ayədə Allah-Təala Hz. İsanın özünə verdiyi nemətlərini bəyan edir, necə ki əvvəldə qeyd olundu. Burada qeyd olunmaqla Ali-İmran surəsində qeyd olunması arasında bir ziddiyyət yoxdur).

**111)** (وَإِذْ أَوْحَيْتُ إِلَى الْحَوَارِيِّينَ) – (ey Məhəmməd, onu yadına sal ki), **İsa vasitəsilə vəhy göndərib* həvarilərə əmr edib dedim:** (أَنْ آمِنُوا بِي وَبِرَسُولِي) – **“Mənə və mənim peyğəmbərimə** (Hz. İsaya) **iman gətirin”.** (قَالُوا آمَنَّا وَاشْهَدْ بِأَنَّنَا مُسْلِمُونَ) – **onlar dedilər: “İman gətirdik, şahid ol, ilahi, biz sənə və sənin peyğəmbərinə xalis itaət edənik”,**

*(*Qeyd:* *Həvari – Hz. İsanın ən yaxın yoldaşlarına deyilir, çünki Hz. İsanın 12 şagirdindən yaxın dostu yox idi. O səbəbdən onlara həvari deyilir) .*

**112)** (إِذْ قَالَ الْحَوَارِيُّونَ يَا عِيسَى ابْنَ مَرْيَمَ) – (ey Məhəmməd, yadına sal ki), **Hz. İsanın şagirdləri** (onu adıyla çağırıb) **dedilər: “Ey İsa Məryəm oğlu.*** (هَلْ يَسْتَطِيعُ رَبُّكَ أَنْ يُنَزِّلَ عَلَيْنَا مَائِدَةً مِنَ السَّمَاءِ) **- bəs sənin rəbbinin qüdrəti var ki, səmadan içində yemək olan bir süfrə göndərsin, biz də o yeməkdən yeyək?”** (قَالَ اتَّقُوا اللَّهَ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ) – (Hz. İsa) **dedi: “Əgər iman gətiribsinizsə, Allah-Təaladan qorxub belə sözlər danışmayın”.**

قَالُوا نُرِيدُ أَنْ نَأْكُلَ مِنْهَا وَتَطْمَئِنَّ قُلُوبُنَا وَنَعْلَمَ أَنْ قَدْ صَدَقْتَنَا وَنَكُونَ عَلَيْهَا مِنَ الشَّاهِدِينَ ﴿١١٣﴾
قَالَ عِيسَى ابْنُ مَرْيَمَ اللَّهُمَّ رَبَّنَا أَنْزِلْ عَلَيْنَا مَائِدَةً مِنَ السَّمَاءِ تَكُونُ لَنَا عِيدًا لِأَوَّلِنَا وَآخِرِنَا وَآيَةً
مِنْكَ وَارْزُقْنَا وَأَنْتَ خَيرُ الرَّازِقِينَ ﴿١١٤﴾ قَالَ اللَّهُ إِنِّي مُنَزِّلُهَا عَلَيْكُمْ فَمَنْ يَكْفُرْ بَعْدُ مِنْكُمْ فَإِنِّي
أُعَذِّبُهُ عَذَابًا لَا أُعَذِّبُهُ أَحَدًا مِنَ الْعَالَمِينَ ﴿١١٥﴾

---

*(****Qeyd:*** *Şagirdlərin imanları hələ kamilləşməmişdən qabaq bu sualı cənab İsaya verdilər. Necə ki çağıranda da: "Ey İsa, dedilər, ədəbə riayət edib, - ya peyğəmbər," demədilər və yenə dedilər: "Bu süfrəni gətir ki, sənin doğru peyğəmbər olduğunu bilək," bunlar aşkar dəlildir ki, bu sualı verəndə tam imanları yox idi. Buradan məlum olur ki, əvvəlki ayədə dedikləri - biz Allah-Təalaya və İsaya iman gətirdik – sözləri səmimi-qəlbən deyildi, süfrə gələndən sonra onların imanı kamilləşdi).*

**113) (قَالُوا نُرِيدُ أَنْ نَأْكُلَ مِنْهَا) – şagirdlər dedilər: "Bizim yemək istəməkdə məqsədimiz odur ki, o yeməkdən yeyək. (وَتَطْمَئِنَّ قُلُوبُنَا) – o yemək bizdən ötrü möcüzə olub iman gətirməkdə qəlbimiz rahat olsun. (وَنَعْلَمَ أَنْ قَدْ صَدَقْتَنَا) – və agah olaq ki, sən bizə doğru deyirsən. Allah-Təala tərəfindən peyğəmbərsən. (وَنَكُونَ عَلَيْهَا مِنَ الشَّاهِدِينَ) – və o yeməyə bəni-İsrailin yanında şahid olaq ki, onlar da sənə iman gətirsinlər".** (Ondan sonra Hz. İsa həvarilərə əmr etdi və onlar 30 gün oruc tutdular. 30 gün tamam olandan sonra dua etməkdən ötrü bir yerə toplandılar. Hz. İsa qüsl edib, əyninə yun libas geyib iki rükət namaz qıldı. Ondan sonra başladı dua etməyə. Bu əhvalat növbəti ayədə qeyd olunur).

**114) (قَالَ عِيسَى ابْنُ مَرْيَمَ اللَّهُمَّ رَبَّنَا) – İsa Məryəm oğlu dua edib dedi: "Ey bizə tərbiyə verən rəbbimiz, Allahımız, (أَنْزِلْ عَلَيْنَا مَائِدَةً مِنَ السَّمَاءِ) – bizə səmadan bir yemək süfrəsi göndər. (تَكُونُ لَنَا عِيدًا لِأَوَّلِنَا وَآخِرِنَا وَآيَةً مِنْكَ) – o süfrənin gəldiyi gün həm bizə, həm bu zamanda olanlara və həm də bundan sonra gələnlərə bayram olsun və sənin tərəfindən mənim haqq peyğəmbər olmağım haqda da möcüzə olsun. (وَارْزُقْنَا وَأَنْتَ خَيرُ الرَّازِقِينَ) – öz lütf və rəhmətindən bu süfrəni bizə ruzi ver. Ruzi verənlərin ən yaxşısı sənsən".**

**115) (قَالَ اللَّهُ إِنِّي مُنَزِّلُهَا عَلَيْكُمْ) – Allah-Təala buyurdu: "Ey İsa, mən o süfrəni sizə nazil edərəm, (فَمَنْ يَكْفُرْ بَعْدُ مِنْكُمْ) – kim o süfrə göndəriləndən sonra kafir olsa, (فَإِنِّي أُعَذِّبُهُ عَذَابًا لَا أُعَذِّبُهُ أَحَدًا مِنَ الْعَالَمِينَ) – həqiqətən, mən o kafir olan şəxsə aləmlərdən heç bir nəfərə etmədiyim kimi əzab edərəm".** (elə ki Hz. İsa duanı bitirdi, səmadan üstündə qırmızı dəsmal olan bir süfrə gəldi, Hz. İsa ağladı. Buyurdu: "Sizdən kimin əməli gözəldirsə, durub bu dəsmalı gətirsin". Həvarilərin rəisi Şimon dedi: "Sən özün buna layiqsən, ey Hz. İsa". Hz. İsa gedib süfrəni gətirdi. Gördü ki, bir balıqdır*, nə pulu var, nə sümüyü, bədənindən yağ tökülür. Baş tərəfində duz, quyruq tərəfində sirkə, ətrafında hər cür tərəvəz var. 5 ədəd çörək, birincisinin üstündə zeytun, ikincisində bal,

وَإِذْ قَالَ اللَّهُ يَا عِيسَى ابْنَ مَرْيَمَ أَأَنْتَ قُلْتَ لِلنَّاسِ اتَّخِذُونِي وَأُمِّيَ إِلَهَيْنِ مِنْ دُونِ اللَّهِ قَالَ سُبْحَانَكَ
مَا يَكُونُ لِي أَنْ أَقُولَ مَا لَيْسَ لِي بِحَقٍّ إِنْ كُنْتُ قُلْتُهُ فَقَدْ عَلِمْتَهُ تَعْلَمُ مَا فِي نَفْسِي وَلَا أَعْلَمُ مَا فِي
نَفْسِكَ إِنَّكَ أَنْتَ عَلَّامُ الْغُيُوبِ ﴿١١٦﴾ مَا قُلْتُ لَهُمْ إِلَّا مَا أَمَرْتَنِي بِهِ أَنِ اعْبُدُوا اللَّهَ رَبِّي وَرَبَّكُمْ
وَكُنْتُ عَلَيْهِمْ شَهِيدًا مَا دُمْتُ فِيهِمْ

---

üçüncüsündə yağ, dördüncüsündə pendir, beşincisində bişmiş ət. Şimon dedi: "Ey İsa, bu dünya yeməyidir, yoxsa axirət?" Buyurdu ki, heç birisindən deyil, bu elə bir yeməkdir ki, Allah-Təala öz kamil qüdrəti ilə onu yaradıb, yeyin, Allah-Təalaya şükür edin. O yeməkdən yedilər, ondan sonra o süfrə götürüldü. Süfrə xüsusunda müxtəlif hədislər varid olub. Burada bir hədis qeyd olundu).

*(*__Qeyd:__ Pulsuz və sümüksüz balıq o insana işarədir ki, zahir və batini təqva ilə bəzənib, zahiri balıq pulu kimi parlaq, aydınladan, batini sümük kimi zərər verən olmasın. Hətta balıqdan axan yağ kimi həmişə Allah-Təalanın məxluquna düz xəbər çatdırsın. Allah-Təala tərəfinə hidayət etməkdə bəzən duz yeməyi ləzzətli edən kimi ləzzətli və şəfqətli nəsihətçi olsun, bəzən də sirkə kimi yandıran, heç bir məzəmmət edənin məzəmmətindən qorxmayıb, tərəvəz kimi həmişə təzə və canlı olsun. 5 çörək isə xalq arasında - dünyanın ömrü 5 gündür, zərb-məsəlinə işarədir. Dünya həyatı zeytun __(meyvə)__ kimi bəyənilən, bal kimi şirin, yağ yeməyə dad qatan kimi şəxsin zahir halını islah edib, lakin qiyamətdə pendir mədəni pozduğu kimi dünya əhli tamamən fasid olub pişmiş ət kimi hamısı həşarata yem olub torpağa dönərlər. Ayə və hədislərdə belə gözəl hikmətlərə müxtəlif işarələr olub, gərək həqiqəti dərk edək. Müvəffəq edən Allahdır).*

**116) (وَإِذْ قَالَ اللَّهُ يَا عِيسَى ابْنَ مَرْيَمَ)** – (ey Məhəmməd), **yadına sal ki, qiyamət gündə Allah-Təala İsanı çağırıb dedi: "Ey İsa Məryəm oğlu,** (أَأَنْتَ قُلْتَ لِلنَّاسِ اتَّخِذُونِي وَأُمِّيَ إِلَهَيْنِ مِنْ دُونِ اللَّهِ) – **bəs sən xalqa dedin ki, Allah-Təaladan başqa mənimlə anamı da özünüzə Allah edin?"** (Allah-Təala bilirdi ki, Hz. İsa xalqa belə söz deməyibdir. Bu sözü Hz. İsaya deməkdə məqsədi odur ki, İsanı Allah sayanlar Hz. İsanın özündən bu sözün inkarını eşidəndən sonra daha onların heç bir bəhanəsi qalmasın). **(قَالَ سُبْحَانَكَ مَا يَكُونُ لِي أَنْ أَقُولَ مَا لَيْسَ لِي بِحَقٍّ) – İsa dedi: "İlahi, şirkdən pak və müqəddəssən, haqqım olmayan sözü danışmaq mənə layiq deyil. (إِنْ كُنْتُ قُلْتُهُ فَقَدْ عَلِمْتَهُ) – əgər mən belə söz demiş olsam, həqiqətən, sən özün agahsan, (تَعْلَمُ مَا فِي نَفْسِي) – mənim qəlbimdə olana sən özün bilirsən, (وَلَا أَعْلَمُ مَا فِي نَفْسِكَ) – amma mən sənin müqəddəs zatında olan elmlərə agah deyiləm. (إِنَّكَ أَنْتَ عَلَّامُ الْغُيُوبِ) – həqiqətən, əlbəttə, qeyblərə agah olan sənsən".**

**117) (مَا قُلْتُ لَهُمْ إِلَّا مَا أَمَرْتَنِي بِهِ أَنِ اعْبُدُوا اللَّهَ رَبِّي وَرَبَّكُمْ)** – (İsa deyir:) **"İlahi, mən onlara sənin mənə deməyi əmr etdiyin sözdən başqa heç bir söz demədim. Xalqa dediyim o söz budur: "Mənim rəbbim və sizin rəbbiniz olan bir Allah-Təalaya ibadət edin". (وَكُنْتُ عَلَيْهِمْ شَهِيدًا مَا دُمْتُ فِيهِمْ) – nə qədər ki, onla-**

فَلَمَّا تَوَفَّيْتَنِي كُنْتَ أَنْتَ الرَّقِيبَ عَلَيْهِمْ وَأَنْتَ عَلَى كُلِّ شَيْءٍ شَهِيدٌ ﴿١١٧﴾ إِنْ تُعَذِّبْهُمْ فَإِنَّهُمْ عِبَادُكَ وَإِنْ تَغْفِرْ لَهُمْ فَإِنَّكَ أَنْتَ الْعَزِيزُ الْحَكِيمُ ﴿١١٨﴾ قَالَ اللَّهُ هَذَا يَوْمُ يَنْفَعُ الصَّادِقِينَ صِدْقُهُمْ لَهُمْ جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا رَضِيَ اللَّهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ ﴿١١٩﴾ لِلَّهِ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَمَا فِيهِنَّ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٢٠﴾

---

**rın arasında idim, mən onlara şahid idim, dediklərini bilirdim. (فَلَمَّا تَوَفَّيْتَنِي كُنْتَ أَنْتَ الرَّقِيبَ عَلَيْهِمْ) – nə zaman ki məni vəfat etdirdin, sən özün onlara nəzarətçi olub onların əməllərindən xəbərdar oldun. Onların sözlərindən sən özün agahsan. (وَأَنْتَ عَلَى كُلِّ شَيْءٍ شَهِيدٌ) – əlbəttə, sənsən hər bir şeyə şahid və agah olan,** (mənim nə dediyimi bilirsən, mən belə söz deməmişəm. Mənə iftira edirlər).

**118) (إِنْ تُعَذِّبْهُمْ فَإِنَّهُمْ عِبَادُكَ) – əgər asi bəndələrinə əzab etsən, həqiqətən, onlar sənin öz bəndələrindirlər. (وَإِنْ تَغْفِرْ لَهُمْ فَإِنَّكَ أَنْتَ الْعَزِيزُ الْحَكِيمُ) – əgər bəndələrini bağışlasan, həqiqətən, sən savab verib əzab etməyə qadirsən. Savab verməyin və əzab etməyin hər ikisi hikmət üzrədir".**

**119) (قَالَ اللَّهُ هَذَا يَوْمُ يَنْفَعُ الصَّادِقِينَ صِدْقُهُمْ) – Allah-Təala buyurdu: "Bu qiyamət günü elə bir gündür ki, doğru şəxslərə onların doğru sözləri mənfəət verər,"** (Necə ki Hz. İsa doğru deyib, doğru sözü ona mənfəət verib, nicat tapdı). **(لَهُمْ جَنَّاتٌ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا) – onlardan ötrü ağaclarının və qəsrlərinin altından çaylar axan bağlar var, həmişə o bağlarda olacaqlar. Heç vaxt oradan çıxmazlar. (رَضِيَ اللَّهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ) – Allah-Təala onlardan razıdır, onlar da Allah-Təaladan razıdırlar. (ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ) – böyük olan xeyrə çatıb, nicat tapmaq Allah-Təalanın razı olmasıdır.**

**120) (لِلَّهِ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ وَمَا فِيهِنَّ) – səmaların və yerin, səmalarda və yerdə olan hər bir şeyin səltənət və padşahlığı Allah-Təalaya məxsusdur. (وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) – Allah-Təala hər bir şeyə qadirdir. Heç bir şey onun qüdrətindən kənar olmaz.**

Allaha həmd olsun, Maidə surəsinin təfsiri tamamlandı. Hz. Peyğəmbər buyurdu: "Kim Maidə surəsini oxusa, Allah-Təala ona 10 əcr, savab verər, 10 günahını silər, axirətdə onu 10 dərəcə ucaldar".

## əl-ƏNAM SURƏSİ

6-cı surədir. Məkkədə nazil olub, 165 ayə, 3552 kəlmə və 12422 hərfdir.

بِسْمِ اللهِ الرَّحْمٰنِ الرَّحِيمِ. اَلْحَمْدُ لِلّٰهِ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ وَجَعَلَ الظُّلُمَاتِ وَالنُّورَ ثُمَّ
الَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ يَعْدِلُونَ ﴿١﴾ هُوَ الَّذِي خَلَقَكُمْ مِنْ طِينٍ ثُمَّ قَضٰى أَجَلًا وَأَجَلٌ مُسَمًّى عِنْدَهُ ثُمَّ
أَنْتُمْ تَمْتَرُونَ ﴿٢﴾ وَهُوَ اللّٰهُ فِي السَّمَاوَاتِ وَفِي الْأَرْضِ يَعْلَمُ سِرَّكُمْ وَجَهْرَكُمْ وَيَعْلَمُ مَا تَكْسِبُونَ
﴿٣﴾ وَمَا تَأْتِيهِمْ مِنْ آيَةٍ مِنْ آيَاتِ رَبِّهِمْ إِلَّا كَانُوا عَنْهَا مُعْرِضِينَ ﴿٤﴾

---

**Bismillahir-Rəhmanir-Rəhim**

**1) (اَلْحَمْدُ لِلّٰهِ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ) – həmd-səna o Allah-Təala üçündür ki, səmaları və yeri yaradıbdır, (وَجَعَلَ الظُّلُمَاتِ وَالنُّورَ) – qaranlığı və işığı yoxdan yaradıbdır, (ثُمَّ الَّذِينَ كَفَرُوا بِرَبِّهِمْ يَعْدِلُونَ) – Allah-Təalanın bu kamil qüdrətini düşündükdən sonra kafir olan şəxslərin bütləri öz rəblərinə bərabər şərik saymağa qüdrətləri olmaz.**

**2) (هُوَ الَّذِي خَلَقَكُمْ مِنْ طِينٍ) – sizin rəbbiniz o Allah-Təaladır ki, sizi palçıqdan yaradıbdır,** (atanız Hz. Adəmi palçıqdan yaradıb, siz də onun övladısınız, sizin əsliniz palçıqdandır)**, (ثُمَّ قَضٰى أَجَلًا) – ondan sonra hökm edib, sizdən ötrü müəyyən bir vaxt təyin edibdir ki, o müəyyən vaxtda ölüm sizə gələcəkdir. (وَأَجَلٌ مُسَمًّى عِنْدَهُ) – bir də müəyyən bir vaxt** (qiyamət günü) **vardır, onun elmi Allah-Təalanın yanındadır, o müəyyən vaxtda sizi tamamən bir yerə toplayacaqdır. (ثُمَّ أَنْتُمْ تَمْتَرُونَ) – Allah-Təalanın qüdrətinə və sizi öldürüb diriltməyinə açıq-aşkar olan dəlillərdən sonra yenə siz qiyamət gününə şəkk edirsiniz.**

**3) (وَهُوَ اللّٰهُ فِي السَّمَاوَاتِ وَفِي الْأَرْضِ) – səmalarda və yerdə haqq olan məbud Allah-Təaladır. Ondan başqa, ibadətə layiq olan yoxdur. (يَعْلَمُ سِرَّكُمْ وَجَهْرَكُمْ) – sizin gizlin və aşkar əməllərinizdən agahdır. (وَيَعْلَمُ مَا تَكْسِبُونَ) – o agahdır sizin qazandığınız əməllərinizə, xeyir və şərdən qazandığınız əməllərinizi bilib, xeyrə savab, şərə cəza verər.**

**4) (وَمَا تَأْتِيهِمْ مِنْ آيَةٍ مِنْ آيَاتِ رَبِّهِمْ إِلَّا كَانُوا عَنْهَا مُعْرِضِينَ)** – (ey Məhəmməd)**, Allah-Təala tərəfindən bu məxluqata elə bir açıq-aşkar dəlil gəlməz ki, ondan üz döndərib baxmasınlar,** (Necə ki Qurani-Şərifə baxmırlar)**, halbuki gərək o dəlillərə baxıb diqqət etsinlər.**

فَقَدْ كَذَّبُوا بِالْحَقِّ لَمَّا جَاءَهُمْ فَسَوْفَ يَأْتِيهِمْ أَنْبَاءُ مَا كَانُوا بِهِ يَسْتَهْزِئُونَ ﴿٥﴾ أَلَمْ يَرَوْا كَمْ أَهْلَكْنَا
مِنْ قَبْلِهِمْ مِنْ قَرْنٍ مَكَّنَّاهُمْ فِي الْأَرْضِ مَا لَمْ نُمَكِّنْ لَكُمْ وَأَرْسَلْنَا السَّمَاءَ عَلَيْهِمْ مِدْرَارًا وَجَعَلْنَا
الْأَنْهَارَ تَجْرِي مِنْ تَحْتِهِمْ فَأَهْلَكْنَاهُمْ بِذُنُوبِهِمْ وَأَنْشَأْنَا مِنْ بَعْدِهِمْ قَرْنًا آخَرِينَ ﴿٦﴾ وَلَوْ نَزَّلْنَا
عَلَيْكَ كِتَابًا فِي قِرْطَاسٍ فَلَمَسُوهُ بِأَيْدِيهِمْ لَقَالَ الَّذِينَ كَفَرُوا إِنْ هَذَا إِلَّا سِحْرٌ مُبِينٌ ﴿٧﴾

---

**5) (فَقَدْ كَذَّبُوا بِالْحَقِّ لَمَّا جَاءَهُمْ) – həqiqətən, haqq olan Quran onlara gəldiyi zaman, təkzib etdilər, (فَسَوْفَ يَأْتِيهِمْ أَنْبَاءُ مَا كَانُوا بِهِ يَسْتَهْزِئُونَ) – əlbəttə, təkzib edib istehza etdikləri Quranın xəbərləri – hansı ki onun səbəbinə islam dini ucalıb şirkə qalib olar, tezliklə gəlib onlara yetişər.** (Hz. Peyğəmbər Mədinəyə hicrət edəndən sonra islam dininin tərəqqi etməsi xəbəri Məkkə əhlinə çatırdı, axırda Allah-Təala islama qüvvət verib, islam dini Məkkədə yayılıb, müşriklər zəlil oldular. Bu xəbər Hz. Peyğəmbərin haqq olmasına bir möcüzədir. Hələ Məkkədə olan zaman Məkkə əhlinə bu xəbəri veribdir. Neçə ildən sonra Mədinəyə hicrət edib, ondan sonra islam dininin tərəqqi etməsi xəbəri yavaş-yavaş Məkkə əhlinə yetişdi. Bir neçə zamandan sonra Məkkədə islam dini yayılıb, birdəfəlik islama tabe oldu).

**6) (أَلَمْ يَرَوْا كَمْ أَهْلَكْنَا مِنْ قَبْلِهِمْ مِنْ قَرْنٍ) – bəs bu Məkkə əhli baxıb görmür və eşitmirlər ki, onlardan qabaq keçənlərdən** (Nuh, Ad, Səmud, Lut camaatlarından) nə qədər camaatı həlak etmişik? Hamısının xəbəri onlara çatıbdır. Bəs niyə ibrət almırlar?) **(مَكَّنَّاهُمْ فِي الْأَرْضِ مَا لَمْ نُمَكِّنْ لَكُمْ) – o camaatlar ki, onları həlak etdik, onlara o qədər qüdrət, qüvvət, dünya malı vermişdik ki, sizə - Məkkə əhlinə onları verməmişik. (وَأَرْسَلْنَا السَّمَاءَ عَلَيْهِمْ مِدْرَارًا) – onlara bol nemət verib, dalbadal yağış göndərdik. Yağış səbəbinə onlardan ötrü hər cür nemətlər əmələ gəlirdi. (وَجَعَلْنَا الْأَنْهَارَ تَجْرِي مِنْ تَحْتِهِمْ) – yer üzündə onlardan ötrü qəsrlərinin altından axan çaylar verdik. (فَأَهْلَكْنَاهُمْ بِذُنُوبِهِمْ) – elə ki asi oldular, onları öz günahlarının səbəbinə həlak etdik. (وَأَنْشَأْنَا مِنْ بَعْدِهِمْ قَرْنًا آخَرِينَ) – onları həlak edəndən sonra başqa bir camaatı dünyaya gətirib onların yerində məskun etdik.** (Allah-Təala hər bir asi olan camaatı həlak edib başqa bir camaat gətirib onların yerində sakin etməyə qadirdir).

**7) (وَلَوْ نَزَّلْنَا عَلَيْكَ كِتَابًا فِي قِرْطَاسٍ)** – (ey Məhəmməd), **əgər kağızda yazılmış bir kitabı səmadan nazil edib sənə göndərsək, (فَلَمَسُوهُ بِأَيْدِيهِمْ) – bu Məkkə əhli müşriklər o kitaba əllə toxunub inansalar ki, bu, kağızdan bir kitabdır, (لَقَالَ الَّذِينَ كَفَرُوا إِنْ هَذَا إِلَّا سِحْرٌ مُبِينٌ) – yenə bu kafir olan şəxslər deyərlər: "Bu, ancaq açıq-aşkar olan sehrdir,"** (necə ki bu Qurani-Şərifə iman gətirmirlər, habelə səmadan yerə gələn kitabı gözləriylə gördükləri halda yenə iman gətirməzlər. Məkkə əhlindən bir neçə nəfər dedilər: "Sən səmadan bir kitab gətirməyənə qədər biz sənə iman gətirmərik". Bu ayə onların cavabında nazil olubdur. Məkkə əhlindən bəzisi Hz. Peyğəmbərə dedilər: "Ancaq

وَقَالُوا لَوْلَا أُنْزِلَ عَلَيْهِ مَلَكٌ وَلَوْ أَنْزَلْنَا مَلَكًا لَقُضِيَ الْأَمْرُ ثُمَّ لَا يُنْظَرُونَ ﴿٨﴾ وَلَوْ جَعَلْنَاهُ مَلَكًا
لَجَعَلْنَاهُ رَجُلًا وَلَلَبَسْنَا عَلَيْهِمْ مَا يَلْبِسُونَ ﴿٩﴾

---

mələyin sənə gəldiyini gördüyümüz zaman iman gətirərik". O zaman bu gələn ayə nazil oldu).

**8) (وَقَالُوا لَوْلَا أُنْزِلَ عَلَيْهِ مَلَكٌ) – Məkkə əhli dedi: "Əgər bu Məhəmməd haqq peyğəmbərdirsə, niyə ona elə mələk gəlmir ki, biz də onu açıq-aşkar gözümüzlə görək?"** (Allah-Təala onların cavabında buyurur:) **(وَلَوْ أَنْزَلْنَا مَلَكًا لَقُضِيَ الْأَمْرُ) – əgər biz peyğəmbərə mələk göndərsək, onlar da onu görsələr, o vaxt onların hamısı həlak olub iş bitər. Bir nəfər də onlardan salamat qalmaz. (ثُمَّ لَا يُنْظَرُونَ) – mələk* nazil olandan sonra bir göz yumub açan qədər də onlara möhlət verilməz. Hamısı həlak olarlar.** (Çünki mələyi dərk edə bilməzlər, elə ki mələyi əsl surətində gördülər, tamamən hamısı həlak olarlar).

*(****Qeyd:*** *Şəriət sahibi peyğəmbərlərə o ruhani qüvvəni bəzən mələk, bəzən Ruhül-qüds, bəzən xüsusi adla Cəbrayıl, Mikayıl şəklində göndərdiyi üçün biz də gərək, ona tabe olub həmin adları işlədək, aqilə bir işarə də kafidir, əgər mələyin həqiqətini bəyan etsəm, çox adam çaşıb qalar, əksər şəxslərdə o idrak və qabiliyyət yoxdur ki, onu dərk etsinlər. Nə gözəl deyir Mövlana Cəlaləddin Rumi:*

*Əgər xalq örtülü və kəsif olmasaydı,*
*Əgər xalq zəif və dar düşüncəli olmasaydı.*
*Onun mədhində mənalar verərdim,*
*Bu məntiqdən başqa dodağımı tərpətməzdim.*
*Lakin şahinin loğması o sərçə deyil,*
*İndi çarəsi yağ və su əldə etmək deyil.*
*Mənim dediklərimi anlamaq çətindir,*
*İnsanlar bunları anlamaq həsrətindədir.)*

**9) (وَلَوْ جَعَلْنَاهُ مَلَكًا لَجَعَلْنَاهُ رَجُلًا)** – (əvvəlki ayədə buyurdu: "Onların mələyi görməsi mümkün deyildir, əgər görsələr, hamısı həlak olarlar," bu ayədə buyurur: "Əgər mələyi görmək istəsələr, yenə gərək insan surətində də olsun ki, onu dərk edə bilsinlər"), **əgər biz peyğəmbəri mələk etsək, əlbəttə, onu gərək, sizin kimi bir kişi edək. Sizinlə həmcins olsun ki, onu dərk edəsiniz. Halbuki mələklərin sizinlə həmcinsliyi yoxdur. Necə ola bilər ki, mələk sizə peyğəmbər olsun? (وَلَلَبَسْنَا عَلَيْهِمْ مَا يَلْبِسُونَ) – mələyi insan surətində göndərsək, onlar Hz. Məhəmmədin peyğəmbərliyinə şübhə etdikləri kimi yenə onları şübhəyə salardıq. Onlar - ona agah olduqları halda sən peyğəmbər deyilsən dedikləri kimi, mələyə də - sən peyğəmbər deyilsən, deyərlər. Çünki mələk də kişi surətində olacaqdır. İnsan surətində gəlmiş mələyəm – desə də, onu qəbul etməyəcəklər.**

وَلَقَدِ اسْتُهْزِئَ بِرُسُلٍ مِنْ قَبْلِكَ فَحَاقَ بِالَّذِينَ سَخِرُوا مِنْهُمْ مَا كَانُوا بِهِ يَسْتَهْزِئُونَ ﴿١٠﴾ قُلْ
سِيرُوا فِي الْأَرْضِ ثُمَّ انْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبِينَ ﴿١١﴾ قُلْ لِمَنْ مَا فِي السَّمَاوَاتِ
وَالْأَرْضِ قُلْ لِلَّهِ كَتَبَ عَلَى نَفْسِهِ الرَّحْمَةَ لَيَجْمَعَنَّكُمْ إِلَى يَوْمِ الْقِيَامَةِ لَا رَيْبَ فِيهِ الَّذِينَ خَسِرُوا
أَنْفُسَهُمْ فَهُمْ لَا يُؤْمِنُونَ ﴿١٢﴾

---

**10) (وَلَقَدِ اسْتُهْزِئَ بِرُسُلٍ مِنْ قَبْلِكَ)** – (ey Məhəmməd)**, necə ki sənə istehza etdilər, həqiqətən, səndən əvvəlki peyğəmbərlərə də istehza etdilər.** (Dilxor olmayıb səbir et, necə ki səndən əvvəlki peyğəmbərlər səbir ediblər)**. (فَحَاقَ بِالَّذِينَ سَخِرُوا مِنْهُمْ مَا كَانُوا بِهِ يَسْتَهْزِئُونَ) – istehza edən şəxslərə istehza etmələri səbəbi ilə əzab nazil olub hamısı həlak oldular.**

**11) (قُلْ سِيرُوا فِي الْأَرْضِ)** – (ey Məhəmməd, Məkkə əhli müşriklərə de ki)**,yer üzündə səfər edib,** (Allah-Təalanın əzab etdiyi şəxslərin diyarına gedin. Ad* və Səmud qövmü Mədinə ilə Şam arasında məskun idi. Məkkə əhlinin yolu Şama ticarətə gedəndə oradan keçirdi. Odur ki, Allah-Təala buyurur: "Gedib o camaatın yerlərinə baxıb ibrət alın)**. (ثُمَّ انْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُكَذِّبِينَ) – o yerlərə gedəndən sonra baxıb görün ki, haqqı təkzib edənlərin aqibəti necə olubdur?"** (Onların izləri qalıb, özləri isə tamamən Allah-Təalanın qəzəbiylə həlak olublar).

*(*Qeyd:* ***İ****ndi də Şam yolu ilə Məkkəyə gedənlərin yolu həmin Ad və Səmud diyarından keçir. Ayənin hökmü ümumi olduğundan o yoldan Məkkəyə gedən hacılar da o diyarlardan ibrət almalıdırlar).*

**12) (قُلْ لِمَنْ مَا فِي السَّمَاوَاتِ وَالْأَرْضِ)** – (ey Məhəmməd)**, müşriklərə və haqqı təkzib edənlərə de ki, səmalarda və yerdə olan məxluqatın səltənəti kimə məxsusdur? (قُلْ لِلَّهِ)** – (ey Məhəmməd)**, onların bu suala cavab verməməsi üçün sən özün bu sualın cavabında de ki, səltənət Allah-Təalanındır,** (siz də bunu inkar edə bilməzsiniz)**, nəinki sizin bütlərə, onlardan insana heç bir zərər və mənfəət gəlməz. (كَتَبَ عَلَى نَفْسِهِ الرَّحْمَةَ) – səmaların və yerin səltənətinə sahib olan Allah-Təala öz pak, müqəddəs zatına vacib edibdir ki, bəndələrinə rəhm edib onların tövbələrini qəbul etsin. Allah-Təalanın tərəfinə gəlin, tövbə edin, Allah-Təalanın sifətləri ilə bəzənin, Allah-Təala da sizə öz rəhmətini şamil edib sizə axirət əzabından nicat versin. (لَيَجْمَعَنَّكُمْ إِلَى يَوْمِ الْقِيَامَةِ لَا رَيْبَ فِيهِ) – əlbəttə, olacağına heç bir şübhə olmayan qiyamət günündə Allah-Təala sizi toplayacaqdır, ondan sonra sizin əməllərinizin qarşılığını sizə verəcəkdir. (الَّذِينَ خَسِرُوا أَنْفُسَهُمْ فَهُمْ لَا يُؤْمِنُونَ) – o şəxslər ki özlərinə zərər verib, şirkdə sabitqədəm olub, onlar iman gətirməzlər.** (Ey Məhəmməd, onların iman etməsindən ümidini birdəfəlik kəs).

وَلَهُ مَا سَكَنَ فِي اللَّيْلِ وَالنَّهَارِ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿١٣﴾ قُلْ أَغَيْرَ اللَّهِ أَتَّخِذُ وَلِيًّا فَاطِرِ السَّمَاوَاتِ
وَالْأَرْضِ وَهُوَ يُطْعِمُ وَلَا يُطْعَمُ قُلْ إِنِّي أُمِرْتُ أَنْ أَكُونَ أَوَّلَ مَنْ أَسْلَمَ وَلَا تَكُونَنَّ مِنَ الْمُشْرِكِينَ
﴿١٤﴾ قُلْ إِنِّي أَخَافُ إِنْ عَصَيْتُ رَبِّي عَذَابَ يَوْمٍ عَظِيمٍ ﴿١٥﴾ مَنْ يُصْرَفْ عَنْهُ يَوْمَئِذٍ فَقَدْ رَحِمَهُ
وَذَلِكَ الْفَوْزُ الْمُبِينُ ﴿١٦﴾ وَإِنْ يَمْسَسْكَ اللَّهُ بِضُرٍّ فَلَا كَاشِفَ لَهُ إِلَّا هُوَ وَإِنْ يَمْسَسْكَ بِخَيْرٍ فَهُوَ
عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿١٧﴾ وَهُوَ الْقَاهِرُ فَوْقَ عِبَادِهِ وَهُوَ الْحَكِيمُ الْخَبِيرُ ﴿١٨﴾

---

**13) (وَلَهُ مَا سَكَنَ فِي اللَّيْلِ وَالنَّهَارِ) – gecə-gündüz yerdə sakin olan insanlar, heyvanlar Allah-Təalanın mülküdür. Onun qüdrətindən kənar ola bilməzlər. (وَهُوَ السَّمِيعُ الْعَلِيمُ) – Allah-Təala xalqın sözlərini eşidib, onların batinlərindən agah olandır.**

**14) (قُلْ أَغَيْرَ اللَّهِ أَتَّخِذُ وَلِيًّا)** – (ey Məhəmməd, müşriklərə de ki), **Allah-Təaladan başqasını özümə məbud və köməkçi edim? (فَاطِرِ السَّمَاوَاتِ وَالْأَرْضِ) – hansı ki o Allah səmaları və yeri yoxdan meydana gətiribdir. Belə Allah-Təaladan başqasını mən özümə məbud edim, necə ki siz bütləri özünüzdən ötrü məbud edibsiniz? (وَهُوَ يُطْعِمُ وَلَا يُطْعَمُ) – odur xalqa ruzi verən, onun ruziyə ehtiyacı yoxdur.** (Belə Allah-Təaladan başqasını özümə məbud etməm mümkün deyildir). **(قُلْ إِنِّي أُمِرْتُ أَنْ أَكُونَ أَوَّلَ مَنْ أَسْلَمَ)** – (ey Məhəmməd), **de ki, həqiqətən, mən Allah-Təala tərəfindən əmr olunmuşam ki, Allah-Təalaya ilk itaət edən mən olum. (وَلَا تَكُونَنَّ مِنَ الْمُشْرِكِينَ) – (ey Məhəmməd, de:), Allah-Təala mənə əmr edibdir ki, müşriklərdən olma,** (Allah-Təalaya sitayiş edib müvəhhid ol)**.**

**15) (قُلْ إِنِّي أَخَافُ إِنْ عَصَيْتُ رَبِّي عَذَابَ يَوْمٍ عَظِيمٍ)** – (ey Məhəmməd), **de ki, əgər mən rəbbim Allah-Təalaya asi olsam, həqiqətən, böyük olan bir günün** (qiyamət gününün) **əzabından qorxaram ki, o gündə mənə əzab etsin.**

**16) (مَنْ يُصْرَفْ عَنْهُ يَوْمَئِذٍ فَقَدْ رَحِمَهُ) – kim ki qiyamət günündə Allah-Təalanın əzabından qurtulub, ona əzab olunmasa, həqiqətən, Allah-Təala ona rəhm edib, ona əzabdan nicat veribdir. (وَذَلِكَ الْفَوْزُ الْمُبِينُ) – əzabdan zahir və aşkar şəkildə nicat tapmaq Allah-Təalanın rəhmətidir.**

**17) (وَإِنْ يَمْسَسْكَ اللَّهُ بِضُرٍّ فَلَا كَاشِفَ لَهُ إِلَّا هُوَ)** – (ey Məhəmməd), **əgər Allah-Təala sənə bir zərər (xəstəlik, ya da yoxsulluq) yetirsə, o zərəri Allah-Təaladan başqa heç kim səndən dəf edə bilməz. (وَإِنْ يَمْسَسْكَ بِخَيْرٍ فَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) – əgər Allah-Təala sənə bir xeyir** (zənginlik və sağlamlıq) **yetirsə, Allah-Təala hər bir şeyə qadirdir.**

**18) (وَهُوَ الْقَاهِرُ فَوْقَ عِبَادِهِ) – bəndələrinin üstündə hakim və qalib olan Allah-Təaladır. Onlar qəhr edilən və zəlildirlər. Onun qüdrət və səltənətindən kənar olan kimdir? (وَهُوَ الْحَكِيمُ الْخَبِيرُ) – və hikmət üzrə bəndələrinin işini təyin edib, onların batin və zahirlərinə xəbərdar olan Odur.**

قُلْ أَيُّ شَيْءٍ أَكْبَرُ شَهَادَةً قُلِ اللّٰهُ شَهِيدٌ بَيْنِي وَبَيْنَكُمْ وَأُوحِيَ إِلَيَّ هَذَا الْقُرْآنُ لِأُنْذِرَكُمْ بِهِ وَمَنْ بَلَغَ أَئِنَّكُمْ لَتَشْهَدُونَ أَنَّ مَعَ اللّٰهِ آلِهَةً أُخْرَى قُلْ لَا أَشْهَدُ قُلْ إِنَّمَا هُوَ إِلَٰهٌ وَاحِدٌ وَإِنَّنِي بَرِيءٌ مِمَّا تُشْرِكُونَ ﴿١٩﴾ الَّذِينَ آتَيْنَاهُمُ الْكِتَابَ يَعْرِفُونَهُ كَمَا يَعْرِفُونَ أَبْنَاءَهُمُ

---

**19) (قُلْ أَيُّ شَيْءٍ أَكْبَرُ شَهَادَةً)** – (ey Məhəmməd)**, bu Məkkə əhli müşriklərə de ki, siz məndən mənim peyğəmbər olmağıma şahid və möcüzə istəyirsiniz, o, hansı şahiddir ki, şahidlikdə hamıdan böyük olub, onun şahidliyi qəbul edilsin? Belə ki, mən də onu sizdən ötrü şahid gətirim.** (Məkkə əhli Hz. Peyğəmbərin doğruluğuna şahid və möcüzə istədilər. Bu ayə onların cavabında nazil oldu.) **(قُلِ اللّٰهُ شَهِيدٌ بَيْنِي وَبَيْنَكُمْ)** – (ey Məhəmməd)**, de ki, o böyük olan şahid Allah-Təaladır, mənimlə sizin aranızda şahiddir. Mənim haqq olmağıma, sizin batil olmağınıza şahidlik edər. (وَأُوحِيَ إِلَيَّ هَذَا الْقُرْآنُ لِأُنْذِرَكُمْ بِهِ وَمَنْ بَلَغَ) – bu Quran* Allah-Təala tərəfindən mənə vəhy olunub nazil olubdur ki, həmin bu Quranın səbəbinə siz Qüreyş camaatını və hər o şəxs ki, dünyada bundan sonra bu Quran ona yetişsə, onu Allah-Təala tərəfinə dəvət edib, əzabla qorxudum. (أَئِنَّكُمْ لَتَشْهَدُونَ أَنَّ مَعَ اللّٰهِ آلِهَةً أُخْرَى) – bəs siz müşriklər Allah-Təala ilə birlikdə başqa məbudların da olmasına şahidlik edirsiniz? Bütləri Allah-Təalaya şərik qoşursunuz? (قُلْ لَا أَشْهَدُ)** – (ey Məhəmməd)**, sən de ki, əgər siz bu şəhadəti etsəniz də, mən bu şəhadəti etmərəm. (قُلْ إِنَّمَا هُوَ إِلَٰهٌ وَاحِدٌ)** – (ey Məhəmməd)**, de ki, bəlkə, mən şəhadət edirəm ki, həqiqətən, Allah-Təala yeganə olan müqəddəs, pak zatdır, şəriki və tayı yoxdur. (وَإِنَّنِي بَرِيءٌ مِمَّا تُشْرِكُونَ) – həqiqətən, Allah-Təalaya şərik qoşduqlarınızdan mən kənaram.**

*(***Qeyd:** Ağıl sahibləri buna diqqət etsinlər ki, nə vaxt Hz. Məhəmmədin (ə.s), peyğəmbərliyinə şahid və ya möcüzə istəsələr, hər dəfə Qurani-Şərif dəlil göstərilibdir. Özgə yalançı iddia edənlər kimi xalqı aldadan sözlər deyilməyibdir. Bu mətləbdən Hz. Peyğəmbərin müdrik və aqil insan olduğu məlum olur. Həmin ayə buna dəlildir ki, Hz. Peyğəmbər bütün məxluqata peyğəmbərdir və Qurani-Şərif qiyamətə qədər gələn məxluqat üçün nazil olubdur. Quranın dəvəti kimə yetişibsə, sanki indi Allah-Təaladan nazil olmuş kimi o şəxsi Allah-Təala tərəfinə dəvət edər. Hz. Məhəmməd (ə.s), Allah-Təala tərəfindən peyğəmbər gəlib, öz vəzifəsini edib, Allah-Təalanın dərgahına getdi. Amma Qurani-Şərif – həqiqi peyğəmbər qiyamətədək gecə-gündüz asi və zəlil şəxsləri Allah-Təalaya tərəf dəvət edir. Heç bir şəxs də deyə bilməz ki, mənə peyğəmbər gəlməyibdir. Çünki həqiqi peyğəmbər – Qurani-Şərif bizim aramızda mövcuddur. Quranın dəvəti kifayət edər. Hz. Məhəmməddən sonra başqa peyğəmbər lazım deyil. Qurani-Şərif qiyamətədək külli məxluqata kifayət edən bir əməl kitabıdır).*

**20) (الَّذِينَ آتَيْنَاهُمُ الْكِتَابَ يَعْرِفُونَهُ كَمَا يَعْرِفُونَ أَبْنَاءَهُمُ) – o şəxslər (yəhudi, xristian) ki, onlara kitab vermişik, onların üləmaları bu peyğəmbəri öz oğullarını tanıdıqları kimi tanıyırlar,** (çünki Allah-Təala Tövrat və İncildə onun

الَّذِينَ خَسِرُوا أَنْفُسَهُمْ فَهُمْ لَا يُؤْمِنُونَ ﴿٢٠﴾ وَمَنْ أَظْلَمُ مِمَّنِ افْتَرَى عَلَى اللهِ كَذِبًا أَوْ كَذَّبَ
بِآيَاتِهِ إِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ ﴿٢١﴾ وَيَوْمَ نَحْشُرُهُمْ جَمِيعًا ثُمَّ نَقُولُ لِلَّذِينَ أَشْرَكُوا أَيْنَ شُرَكَاؤُكُمُ
الَّذِينَ كُنْتُمْ تَزْعُمُونَ ﴿٢٢﴾ ثُمَّ لَمْ تَكُنْ فِتْنَتُهُمْ إِلَّا أَنْ قَالُوا وَاللهِ رَبِّنَا مَا كُنَّا مُشْرِكِينَ ﴿٢٣﴾
انْظُرْ كَيْفَ كَذَبُوا عَلَى أَنْفُسِهِمْ وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ ﴿٢٤﴾ وَمِنْهُمْ مَنْ يَسْتَمِعُ إِلَيْكَ
وَجَعَلْنَا عَلَى قُلُوبِهِمْ أَكِنَّةً أَنْ يَفْقَهُوهُ وَفِي آذَانِهِمْ وَقْرًا

---

haqq peyğəmbər olduğunu xəbər veribdir. Məkkə əhli Hz. Peyğəmbərə dedi: “Yəhudi və xristianlardan soruşduq ki, sizin kitablarınızda belə bir şəxsin gələcəyi qeyd olunubmu? Onlar - bizim kitablarda belə şəxs haqqında xəbər yoxdur, dedilər”. Bu ayə onların iddiasını rədd etmək üçün nazil oldu). (الَّذِينَ خَسِرُوا أَنْفُسَهُمْ فَهُمْ لَا يُؤْمِنُونَ) – **əhli-kitab alimləri kafir olmaqla özlərinə zərər veriblər, onlar heç vaxt iman gətirməzlər.**

**21) (وَمَنْ أَظْلَمُ مِمَّنِ افْتَرَى عَلَى اللهِ كَذِبًا أَوْ كَذَّبَ بِآيَاتِهِ) – o şəxslər ki Allah-Təalaya iftira atıb, onun açıq-aşkar ayələrini inkar edib, təkzib edir, onlardan daha zalım olan kimdir? (إِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ) – həqiqətən, Allah-Təalaya iftira atan və möcüzələrini təkzib edən zalımlar axirət əzabından nicat tapmazlar.**

**22) (وَيَوْمَ نَحْشُرُهُمْ جَمِيعًا) – müşriklər bunu yadlarına salsınlar ki, onların özlərini və məbudlarını** (qiyamət günündə) **tamamən bir yerə toplayarıq. (ثُمَّ نَقُولُ لِلَّذِينَ أَشْرَكُوا) – ondan sonra müşriklərə deyərik: (أَيْنَ شُرَكَاؤُكُمُ الَّذِينَ كُنْتُمْ تَزْعُمُونَ) – bu gün hanı sizin o məbudlarınız ki, onları Allah-Təalaya şərik qoşub - bunlar bizdən ötrü Allah-Təala yanında şəfaət edərlər, deyirdiniz? Gəlib bu gün şəfaət etsinlər. O zaman müşriklərin hamısı sakit olub cavab verə bilməzlər.**

**23) (ثُمَّ لَمْ تَكُنْ فِتْنَتُهُمْ إِلَّا أَنْ قَالُوا وَاللهِ رَبِّنَا) – o sualdan sonra onların küfr və şirklərinin aqibəti bu olar ki, dinlərini inkar edib cavabda deyərlər: “Rəbbimiz yeganə olan Allahdır. (مَا كُنَّا مُشْرِكِينَ) – biz müşrik olmayıb, Allah-Təalaya şərik qoşmamışıq”.**

**24) (انْظُرْ كَيْفَ كَذَبُوا عَلَى أَنْفُسِهِمْ)** – (ey Məhəmməd), **bax gör ki, axirət günündə bu müşriklər özlərini necə təkzib edirlər, belə xəyal edirlər ki, bu təkzib etmək axirət günündə onlara bir fayda verər. (وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ) – o bütlər ki, onların şəfaətinə ümid edib, Allah-Təalaya şərik qoşurdular, axirətdə onlardan qeyb olub onlara kömək etməzlər.**

**25) (وَمِنْهُمْ مَنْ يَسْتَمِعُ إِلَيْكَ)** – (ey Məhəmməd), **müşriklərdən bəzi şəxslər vardır ki, Quran oxuyanda sənə qulaq asarlar, amma iman gətirməzlər. (وَجَعَلْنَا عَلَى قُلُوبِهِمْ أَكِنَّةً أَنْ يَفْقَهُوهُ وَفِي آذَانِهِمْ وَقْرًا) – onların küfr və inadlarına görə,**

وَإِنْ يَرَوْا كُلَّ آيَةٍ لَا يُؤْمِنُوا بِهَا حَتَّى إِذَا جَاءُوكَ يُجَادِلُونَكَ يَقُولُ الَّذِينَ كَفَرُوا إِنْ هَذَا إِلَّا أَسَاطِيرُ الْأَوَّلِينَ ﴿٢٥﴾ وَهُمْ يَنْهَوْنَ عَنْهُ وَيَنْأَوْنَ عَنْهُ وَإِنْ يُهْلِكُونَ إِلَّا أَنْفُسَهُمْ وَمَا يَشْعُرُونَ ﴿٢٦﴾ وَلَوْ تَرَى إِذْ وُقِفُوا عَلَى النَّارِ فَقَالُوا يَا لَيْتَنَا نُرَدُّ وَلَا نُكَذِّبَ بِآيَاتِ رَبِّنَا وَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ ﴿٢٧﴾ بَلْ بَدَا لَهُمْ مَا كَانُوا يُخْفُونَ مِنْ قَبْلُ وَلَوْ رُدُّوا لَعَادُوا لِمَا نُهُوا عَنْهُ وَإِنَّهُمْ لَكَاذِبُونَ ﴿٢٨﴾ وَقَالُوا إِنْ هِيَ إِلَّا حَيَاتُنَا الدُّنْيَا

---

**Quranı anlayıb dərk etməmələri üçün onların qəlblərinə pərdələr çəkib, qulaqlarına ağırlıq** (karlıq) **verdik ki, Quranı anlamaqda və ilahi ayələri eşitməkdə onlara mane olsun. (وَإِنْ يَرَوْا كُلَّ آيَةٍ لَا يُؤْمِنُوا بِهَا) – bu müşriklər hər nə möcüzə görsələr, ona iman gətirməzlər. (حَتَّى إِذَا جَاءُوكَ يُجَادِلُونَكَ) – müşriklər nə zaman sənin yanına gəlsələr, gələndən sonra səninlə mübahisəyə və mücadiləyə başlayarlar. (يَقُولُ الَّذِينَ كَفَرُوا إِنْ هَذَا إِلَّا أَسَاطِيرُ الْأَوَّلِينَ) – Qurana qulaq asıb, səninlə mübahisə və mücadilə edəndən sonra kafir və müşriklər deyərlər: "Bu, Quranın sözləri deyil, bundan qabaq keçənlərin əslsiz olan sözləridir. Biz o sözlərə iman gətirmərik".**

**26) (وَهُمْ يَنْهَوْنَ عَنْهُ وَيَنْأَوْنَ عَنْهُ) – o müşriklər xalqın Qurana iman gətirməsini qadağan edib, mane olarlar. Özləri də iman gətirməkdən kənar olub uzaq durarlar. (وَإِنْ يُهْلِكُونَ إِلَّا أَنْفُسَهُمْ وَمَا يَشْعُرُونَ) – onlar ancaq özlərinə zərər verib, həlak edərlər, özlərindən başqa heç bir kəsə zərər yetirə bilməzlər. Amma o qədər şüurları yoxdur ki, zərəri dərk edib zərərdən qaçsınlar.**

**27) (وَلَوْ تَرَى إِذْ وُقِفُوا عَلَى النَّارِ) –** (ey Məhəmməd), **qiyamət günündə müşriklərin cəhənnəm odunun içinə salınmaq üçün onun kənarında pis bir halda saxlanılmalarını bir görsən, (فَقَالُوا يَا لَيْتَنَا نُرَدُّ وَلَا نُكَذِّبَ بِآيَاتِ رَبِّنَا) – deyərlər ki, kaş nə olardı, bizi dünyaya qaytaraydılar, rəbbimiz Allah-Təalaya iman gətirib, onun tövhid və qüdrətinə işarə edən dəlillərini təkzib etməyəydik? (وَنَكُونَ مِنَ الْمُؤْمِنِينَ) – və kaş Allah-Təalaya iman gətirənlərdən olaydıq.**

**28) (بَلْ بَدَا لَهُمْ مَا كَانُوا يُخْفُونَ مِنْ قَبْلُ) – xeyr, müşriklərin dediyi kimi deyil ki, dünyaya təkrar gəlib, iman gətirsinlər. Bəlkə, bundan qabaq dünyada gizlətdikləri qəbih şeyləri - əməlləri indi** (qiyamət günü) **aşkar olub, görərlər ki, onlara əzab olunacaqdır. O səbəbdən dünyaya qayıdıb iman gətirməyi arzu edərlər. (وَلَوْ رُدُّوا لَعَادُوا لِمَا نُهُوا عَنْهُ) – əgər dünyaya qaytarılsalar, yenə qadağan edildikləri küfr və şirk tərəfinə qayıdıb müşrik olarlar. (وَإِنَّهُمْ لَكَاذِبُونَ) – həqiqətən, müşriklər axirətdə də iddialarında yalançıdırlar, heç vaxt iman gətirən deyildirlər.**

**29) (وَقَالُوا إِنْ هِيَ إِلَّا حَيَاتُنَا الدُّنْيَا) – bu iddianı edən müşriklər həmin şəxslərdir ki, dünyada qiyamət gününü inkar edib deyirdilər: "Həyat ancaq dünya-**

وَمَا نَحْنُ بِمَبْعُوثِينَ ﴿٢٩﴾ وَلَوْ تَرَى إِذْ وُقِفُوا عَلَى رَبِّهِمْ قَالَ أَلَيْسَ هَذَا بِالْحَقِّ قَالُوا بَلَى وَرَبِّنَا قَالَ
فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ ﴿٣٠﴾ قَدْ خَسِرَ الَّذِينَ كَذَّبُوا بِلِقَاءِ اللَّهِ حَتَّى إِذَا جَاءَتْهُمُ السَّاعَةُ
بَغْتَةً قَالُوا يَا حَسْرَتَنَا عَلَى مَا فَرَّطْنَا فِيهَا وَهُمْ يَحْمِلُونَ أَوْزَارَهُمْ عَلَى ظُهُورِهِمْ أَلَا سَاءَ مَا يَزِرُونَ
﴿٣١﴾ وَمَا الْحَيَاةُ الدُّنْيَا إِلَّا لَعِبٌ وَلَهْوٌ وَلَلدَّارُ الْآخِرَةُ خَيْرٌ لِلَّذِينَ يَتَّقُونَ أَفَلَا تَعْقِلُونَ ﴿٣٢﴾

---

**dakı həyatımızdır. (وَمَا نَحْنُ بِمَبْعُوثِينَ) – əlbəttə, bir də biz dirilmərik”.** (Müşriklərin halı belədir, əgər təkrar dünyaya qayıtsalar, yenə qiyaməti inkar edərlər)**.**

**30) (وَلَوْ تَرَى إِذْ وُقِفُوا عَلَى رَبِّهِمْ) –** (ey Məhəmməd)**, əgər qiyamət günündə müşriklərin Allah-Təalanın hüzurunda saxlandığını bir görsən, (قَالَ أَلَيْسَ هَذَا بِالْحَقِّ) – Allah-Təala müşriklərlə danışıb deyər: “Bugünü ki inkar edirdiniz, bəs haqq olmadı, yenə inkar edirsinizmi?” (قَالُوا بَلَى وَرَبِّنَا) – müşriklər deyərlər: “Bəli, rəbbimiz Allah-Təalaya and olsun, qiyamət günü haqq olan gün imiş”. (قَالَ فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ) – Allah-Təala deyər: “Qiyamət gününü inkar etdiyiniz üçün dadın əzabı. İndi təsdiq etmək sizə bir fayda verməz”.**

**31) (قَدْ خَسِرَ الَّذِينَ كَذَّبُوا بِلِقَاءِ اللَّهِ) – həqiqətən, Allah-Təalanın tərəfinə getməyi, yenidən dirilməyi təkzib edənlər özlərinə ziyankar oldular, (حَتَّى إِذَا جَاءَتْهُمُ السَّاعَةُ بَغْتَةً) – elə ki qəfildən qiyamət günü* onlara gələr, görərlər ki, qiyamət vaqe oldu. O vaxt da peşman olarlar. (قَالُوا يَا حَسْرَتَنَا عَلَى مَا فَرَّطْنَا فِيهَا) – elə ki qəfildən qiyamət gününü gördülər, deyərlər: “Ey vay təəssüf olsun bizə ki, dünyada günah edib Allah-Təalaya və qiyamət gününə iman gətirmədik”. (وَهُمْ يَحْمِلُونَ أَوْزَارَهُمْ) – qiyaməti inkar edənlər öz müsibət və günahlarının yükünü özləri öz çiyinlərinə götürərlər. Heç bir şəxs onlara kömək olub ilahi əzabi onlardan dəf edə bilməz. (عَلَى ظُهُورِهِمْ أَلَا سَاءَ مَا يَزِرُونَ) – xəbərdar ol ki, qiyamət günündə çox pis ağır olan yük daşıyarlar. O yükdən heç vaxt xilas ola bilməzlər.**

*(****Qeyd:** *Ola bilər ki, bu qiyamətdən məqsəd kiçik qiyamətdir, yəni ölməkdir, necə ki Hz. Peyğəmbər buyurub: “Kim öldü, onun qiyaməti başlayar”).*

**32) (وَمَا الْحَيَاةُ الدُّنْيَا إِلَّا لَعِبٌ وَلَهْوٌ) – dünya həyatı ancaq batil və aldadıcı olan bir şeydir ki, ondan heç bir fayda hasil olmaz, necə ki oyundan, əyləncədən hasil olmaz,** (yəni oyundan, əyləncədən mənfəət olmaz, əgər olsa da, müvəqqəti mənfəət olar, buna görə də əgər kimsə Allah-Təalaya iman gətirməsə, o vaxt o dünyadan həqiqi mənfəət əldə etməz, dünyanın həqiqi mənfəəti o vaxt olar ki, o şəxs Allah-Təalaya və axirətə iman gətirsin. İman olmasa, dünya həyatından həqiqi mənfəət hasil olmaz. Bu sözə diqqət edilsin). **(وَلَلدَّارُ الْآخِرَةُ خَيْرٌ لِلَّذِينَ يَتَّقُونَ) – əlbəttə, axirət yurdu daha yaxşı və fəzilətlidir. Təqva sahiblərindən ötrü dünya tez fani olan, axirət isə əbədi olandır. (أَفَلَا تَعْقِلُونَ)**

قَدْ نَعْلَمُ إِنَّهُ لَيَحْزُنُكَ الَّذِي يَقُولُونَ فَإِنَّهُمْ لَا يُكَذِّبُونَكَ وَلَكِنَّ الظَّالِمِينَ بِآيَاتِ اللَّهِ يَجْحَدُونَ ﴿٣٣﴾
وَلَقَدْ كُذِّبَتْ رُسُلٌ مِنْ قَبْلِكَ فَصَبَرُوا عَلَى مَا كُذِّبُوا وَأُوذُوا حَتَّى أَتَاهُمْ نَصْرُنَا وَلَا مُبَدِّلَ لِكَلِمَاتِ
اللَّهِ وَلَقَدْ جَاءَكَ مِنْ نَبَإِ الْمُرْسَلِينَ ﴿٣٤﴾

---

**– bəs nəfsani arzuları tərk edib, ağlın hökmüylə hərəkət etməzsiniz? Ağıl buna şahiddir ki, dünya fanidir, əgər axirəti təsdiq etsəniz, sizə nə zərəri olar?**

**33) (قَدْ نَعْلَمُ إِنَّهُ لَيَحْزُنُكَ الَّذِي يَقُولُونَ)** – (ey Məhəmməd), **həqiqətən, biz buna agahıq ki, müşriklərin sənə sehrbaz,* yalançı deməleri səni məhzun və qəmgin edir, bundan qəmgin olma. (فَإِنَّهُمْ لَا يُكَذِّبُونَكَ) – onlar həqiqətdə, səni təkzib etmirlər, (وَلَكِنَّ الظَّالِمِينَ بِآيَاتِ اللَّهِ يَجْحَدُونَ) – lakin bu zalımlar Allah-Təalanın möcüzələrini inkar edirlər. Çünki sənin dediyin sözlər Allah-Təalanın tərəfindəndir. Səni təkzib edənlər Allah-Təalanı təkzib edib onun ayələrini inkar edirlər.**

*(*__Qeyd:__ Qüreyşlilər Hz. Peyğəmbərə Əmin adını vermişdilər. Bilirdilər ki, o, yalançı deyildir. Əbu Cəhl dedi: "Ey Məhəmməd, biz bilirik ki, sən yalan deməzsən, amma bu Quran ayələrini inkar edirik". Əxnəs ibn Şüreyq Əbu Cəhlə dedi: "Ey əbül-Hikəm, mənə de görüm, bu Məhəmməd düz danışandır, yoxsa yox? Mənimlə səndən başqa, burada başqa bir şəxs yoxdur". Əbu Cəhl dedi: "And olsun Allah-Təalaya ki, Məhəmməd heç vaxt yalan deməyibdir. Amma bəni-Haşimdə həm Kəbənin ixtiyarı, həm də peyğəmbərlik olsun? Bəs sair Qüreyşlilərə nə qaldı?")*

**34) (وَلَقَدْ كُذِّبَتْ رُسُلٌ مِنْ قَبْلِكَ)** – (Allah-Təala bu ayədə Hz. Peyğəmbərə təsəlli verib buyurur:) (ey Məhəmməd), **bu müşriklərin səni təkzib etmələrinə səbir et, necə ki bunlar səni təkzib edirlər, həqiqətən, səndən əvvəlki peyğəmbərləri də öz qövmləri təkzib ediblər. Peyğəmbərlər arasında təkzib olunan təkcə sən deyilsən. (فَصَبَرُوا عَلَى مَا كُذِّبُوا وَأُوذُوا حَتَّى أَتَاهُمْ نَصْرُنَا) – o peyğəmbərlər təkzib olunub, əziyyət edilmələrinə səbir etdilər. Ta ki Allah-Təala tərəfindən onlara kömək gəlib, təkzib və əziyyət edənlərin hamısını həlak etdilər, sən də** (ey Məhəmməd), **səbir et, Allah-Təala sənə kömək olub, müşrikləri zəlil* edib, sən onlara qalib olacaqsan. (وَلَا مُبَدِّلَ لِكَلِمَاتِ اللَّهِ) – Allah-Təalanın vədlərini və hökmlərini heç bir şəxs dəyişdirə bilməz. Necə ki Allah-Təala peyğəmbərlərinin qalib gələcəyinə hökm edibdir, əlbəttə, elə də olacaqdır. (وَلَقَدْ جَاءَكَ مِنْ نَبَإِ الْمُرْسَلِينَ)** – (ey Məhəmməd), **əlbəttə, həqiqətən, bu, Qurani-Şərifdə keçən peyğəmbərlərin xəbərlərindən sənə gəlibdir. Onlara nə əziyyət olubsa, səbir ediblər, ondan sonra Allah-Təala onlara kömək olub, qövmlərinə bəla göndərib, onları həlak edibdir.** (ey Məhəmməd), **əvvəlki peyğəmbərlərə tabe olub, səbri özünə şüar seç, əlbəttə, Allah-Təala sənə kömək olub, səni bu müşriklərə qalib edəcəkdir.**

(***Qeyd:** *Allah-Təalanın vədi doğru olub, Hz. Peyğəmbər onların əziyyətinə səbir etdi. Elə ki izin ona verildi, Məkkədən çıxıb, Mədinəyə gəldi, ondan sonra islam dini yayıldı. Allah-Təala müşrikləri tamamən zəlil edib, peyğəmbərini onlara qalib etdi).*

**35) (وَإِنْ كَانَ كَبُرَ عَلَيْكَ إِعْرَاضُهُمْ)** – (ey Məhəmməd)**, hərçənd müşriklərin səndən üz döndərib imana daxil olmaması sənə çox ağır gəlir, səndən bu Qurani-Şərifdən başqa möcüzələr istəyirlər. Sənin də istəyin budur ki, müşriklərin iman gətirməsi üçün o möcüzələr olsun. Amma onların istədikləri heç vaxt olmayacaqdır. Onların istəyinə görə, Qurandan başqa bir möcüzə sənə verilməyəcəkdir. (فَإِنِ اسْتَطَعْتَ أَنْ تَبْتَغِيَ نَفَقًا فِي الْأَرْضِ) – müşriklər səndən nə qədər möcüzə istəsə də, bu Qurandan başqa möcüzə yoxdur. ***

(***Qeyd:** *Möcüzə barəsində nazil olan bu ayə və başqa ayələri düşünəndən sonra demək olar ki, Hz. Peyğəmbər müşriklərin istədiyi başqa möcüzələr də edibdir demək Quranı təkzib etməkdir, o kitablar ki, möcüzə barəsində yazılıbdır, hamısı Qurana müxalifdir, Qurana müxalif sözlər isə batildir. Müsəlman gərək etiqadını Qurani-Şərifdən alsın, Qurana zidd olan şeylərdən üz döndərsin. İndi gərək ya Qurana yapışıb, möcüzələrdən bəhs edən kitabları bir kənara qoyaq, ya da Quranı atıb o kitablara əməl edək, görən hansı doğrudur? Müsəlman Qurandan necə üz döndərə bilər? Amma bu dövrdə Quran insanların arasında birdəfəlik etibardan düşüb, filan mollanın möcüzədən bəhs edən kitabı Qurandan 100 dəfə mötəbər olubdur. O kitabdan bir hədis nəql edəndə cani-dildən onu qəbul edirlər. Amma elə ki onun xilafına Qurani-Şərifdən bir ayə zikr olundu, "Onlara qorxu üz verdikdə can üstə olan (ölüm xofundan bayılan) adam kimi gözləri (o tərəf-bu tərəfə) dolana-dolana sənə baxdıqlarını görərsən" (Əhzab, 19) ayəsində deyilən kimi çaşqın qalarlar, Qurani-Şərifdən bir quru ad və meyit üstündə oxumaqdan başqa bir şey qalmayıbdır. Müsəlmanlar elə xəyal edirlər ki, o möcüzələri Hz. Peyğəmbərə isnad etməklə, ondan ötrü bir şan və böyüklük olar, amma əgər diqqətlə fikir versələr, o möcüzə deyilən şeylərin möcüzəyə oxşar olmayıb, oyunbazların əməlinə oxşaması səbəbi ilə Hz. Peyğəmbərdən ötrü bir qüsur və nöqsan olduğu görülər. Bir halda ki, Qurani-Şərifdə Allah-Təala o möcüzələri qadağan edir, necə demək olar ki, o möcüzələri o edibdir. Möcüzə iki qisimdir: birincisi odur ki, Allah-Təala öz peyğəmbərinə iddiasının müqabilində bir möcüzə bəxş edər. Çünki onun peyğəmbərliyinin doğruluğuna dəlil olan bir şey lazımdır. Bizim peyğəmbərə Allah-Təala bu Qurani-Şərifi möcüzə olaraq bəxş edib, odur ki, Allah-Təala Qurani-Şərifdə peyğəmbərinə buyurur: "Xalqa de ki, əgər mənim peyğəmbərliyimi qəbul etmirsinizsə, bu Quranın surələri kimi bir surə gətirin" (Bəqərə, 23). Həmişə xalqa bu sözü deyibdir. İkinci qismi odur ki, xalq peyğəmbərdən möcüzə istəsin, ona "müqtərih" (ani) möcüzə deyilir. Yəni xalq desin ki, hökmən bu möcüzəni, gərək, gətirəsən, yoxsa sənə iman gətirmərik. Peyğəmbər belə möcüzə göstərməz. Möcüzə kitablarında nəql olunan möcüzələrin hamısı bu cürdür, necə ki Məkkədə peyğəmbərdən cürbəcür möcüzələr istədilər, onların cavabında Allah-Təala buyurur: "De ki, bu möcüzələr ki, siz istəyirsiniz, bunların heç*

أَوْ سُلَّمًا فِي السَّمَاءِ فَتَأْتِيَهُمْ بِآيَةٍ وَلَوْ شَاءَ اللّٰهُ لَجَمَعَهُمْ عَلَى الْهُدَى فَلَا تَكُونَنَّ مِنَ الْجَاهِلِينَ
﴿٣٥﴾ إِنَّمَا يَسْتَجِيبُ الَّذِينَ يَسْمَعُونَ وَالْمَوْتَى يَبْعَثُهُمُ اللّٰهُ ثُمَّ إِلَيْهِ يُرْجَعُونَ ﴿٣٦﴾

---

*biri olmaz, mən bir insanam, Allah-Təala tərəfindən gələn peyğəmbərəm (Kəhf, 110), Allah-Təalanın bəxş etdiyindən başqa möcüzə göstərə bilmərəm". Bu mətləb, inşallah, İsra surəsinin təfsirində bəyan olunacaq. Bəs indi biz Qurana tabe olaq, yoxsa xalqın nəfsani arzularına? Bir çox adam öz nəfsani arzuları ilə möcüzələr yazıb Hz. Peyğəmbərə isnad edib, hamısının səbəbi ağıl sahiblərinin yanında məlumdur, gərək, biz onları hökmən qəbul edək. Bu kitaba baxıb oxuyan şəxslər insaf üzrə baxsınlar, əvvəlcədən tənə etməsinlər, Qurani-Şərifə tam diqqət etsələr, mənim sözlərimin haqq olması onlara aşkar olar. Əgər desən ki, bu möcüzələr hədislərdə nəql olunub, cavab verərik: "Hədisi gərək Quranla yoxlayaq, əgər Quranla uyğun olsa, o hədislə əməl etmək olar," əgər Qurana müxalif olsa, gərək onu batil bilib, tərk edək, o hədislərin hamısı Qurana müxalifdir, heç birisinə inanmaq caiz deyil. İslam dini nəfsani arzulara tabe olmaqla puç olub, Allah-Təala haqq yoldan uzaqlaşan rəhbərlərimizə hidayət etsin. Anlayın!)*

(ey Məhəmməd), **əgər bir yol tapıb, yerin altına daxil olub oradan möcüzə gətirməyə sənin gücün və qüdrətin varsa, (أَوْ سُلَّمًا فِي السَّمَاءِ فَتَأْتِيَهُمْ بِآيَةٍ) – ya da bir nərdivan tapıb səmaya çıxıb, oradan möcüzə gətirməyə qüdrətin varsa, onlardan ötrü möcüzə gətir, halbuki səndə o qüvvət və qüdrət hardandır ki, Allahın izni olmadan onlara möcüzə gətirəsən, hər bir möcüzə ki, Allah-Təala sənə bəxş edib, onunla kifayətlən, müşriklər səndən qəbul etməyəndə sənə ağır gəlməsin. Onları Allah-Təalaya həvalə et. (وَلَوْ شَاءَ اللّٰهُ لَجَمَعَهُمْ عَلَى الْهُدَى) – əgər Allah-Təala istəsə, zorla bütün müşrikləri hidayətə gətirib, islama daxil edər. (Amma bu aləm seçim aləmidir, Allah-Təala insanları öz ixtiyarlarına buraxıb və bu səbəbdən öz əməllərinə görə onlara qarşılıq verəcəkdir). (فَلَا تَكُونَنَّ مِنَ الْجَاهِلِينَ) –** (ey Məhəmməd), **sən cahillərdən olma, Allah-Təalanın insanları bir dində toplaya bilmə qüdrətinə şübhə etmə,** (bu kəlam islam ümməti üçün kinayəli məzəmmətdir).

**36) (إِنَّمَا يَسْتَجِيبُ الَّذِينَ يَسْمَعُونَ) – həqiqətən, ey Məhəmməd, o şəxslər ki Allah-Təalanın göndərdiyi Qurana qulaq asıb, onun hikmətamiz olan sözlərini dərk ediblər, onlar haqqı qəbul edib iman gətirərlər. Amma qulaq asmayan şəxslər** (müşriklər) **sən onların iman gətirməsini çox istəsən də, ölü kimidirlər. Necə ki ölü eşidən və görən deyil, habelə bu müşriklər də haqqı görüb eşitməkdən kor və kardırlar. (وَالْمَوْتَى يَبْعَثُهُمُ اللّٰهُ ثُمَّ إِلَيْهِ يُرْجَعُونَ) – onları Allah-Təala yenidən dirildib öz tərəfinə qaytaracaqdır və onların cəzasını verəcəkdir,** (bu küfrlə ölən müşrikləri də Allah-Təala diriltməyə qadirdir, çünki bu aləm seçim aləmidir, küfr, iman da onların öz ixtiyarları ilə gərək olsun).

وَقَالُوا لَوْلَا نُزِّلَ عَلَيْهِ آيَةٌ مِنْ رَبِّهِ قُلْ إِنَّ اللَّهَ قَادِرٌ عَلَى أَنْ يُنَزِّلَ آيَةً وَلَكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿٣٧﴾
وَمَا مِنْ دَابَّةٍ فِي الْأَرْضِ وَلَا طَائِرٍ يَطِيرُ بِجَنَاحَيْهِ إِلَّا أُمَمٌ أَمْثَالُكُمْ مَا فَرَّطْنَا فِي الْكِتَابِ مِنْ شَيْءٍ ثُمَّ
إِلَى رَبِّهِمْ يُحْشَرُونَ ﴿٣٨﴾ وَالَّذِينَ كَذَّبُوا بِآيَاتِنَا صُمٌّ وَبُكْمٌ فِي الظُّلُمَاتِ مَنْ يَشَأِ اللَّهُ يُضْلِلْهُ وَمَنْ
يَشَأْ يَجْعَلْهُ عَلَى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٣٩﴾ قُلْ أَرَأَيْتَكُمْ إِنْ أَتَاكُمْ عَذَابُ اللَّهِ أَوْ أَتَتْكُمُ السَّاعَةُ أَغَيْرَ اللَّهِ
تَدْعُونَ إِنْ كُنْتُمْ صَادِقِينَ ﴿٤٠﴾

---

**37) (وَقَالُوا لَوْلَا نُزِّلَ عَلَيْهِ آيَةٌ مِنْ رَبِّهِ) – müşriklər dedilər: niyə Allah-Təaladan** (Məhəmmədə) **bu Qurandan başqa bir möcüzə nazil olmur ki, ona iman gətirək,** (əvvəldə qeyd olunan saxta möcüzələrin rəddi üçün bu ayə bir dəlildir), **(قُلْ إِنَّ اللَّهَ قَادِرٌ عَلَى أَنْ يُنَزِّلَ آيَةً)** – (ey Məhəmməd), **de ki, Allah-Təala möcüzə göndərməyə qadirdir, lakin Allah-Təala məsləhətə müvafiq olaraq möcüzə bəxş edər, sizin istəyinizlə olmaz. (وَلَكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) – amma insanların əksəriyyəti Allah-Təalanın məsləhətə görə möcüzə göndərməyə qadir olduğunu bilməyib, sizdən möcüzə istəyirlər. Onların istəyinə görə, möcüzə verilməyəcəkdir.**

**38) (وَمَا مِنْ دَابَّةٍ فِي الْأَرْضِ) – yer üzündə heç bir hərəkət edən yoxdur ki, (وَلَا طَائِرٍ يَطِيرُ بِجَنَاحَيْهِ) – və havada heç bir qanad vurub iki qanadla uçan quşlardan yoxdur ki, (إِلَّا أُمَمٌ أَمْثَالُكُمْ) – onlar da sizin kimi bir ümmət və bir camaat olmasın.** (Onlardan ötrü də ruzi və əcəl təyin olunubdur. Necə ki siz insanlardan ötrü də təyin edilib). **(مَا فَرَّطْنَا فِي الْكِتَابِ مِنْ شَيْءٍ) – bütün varlıqların əhvalatı lövhi-məhfuzda** (ilahi elmdə) **qeyd olunub, heç bir şeyi onlardan kənara qoymamışıq. (ثُمَّ إِلَى رَبِّهِمْ يُحْشَرُونَ) – təyin olunan vaxtları yetişəndən sonra ölüm onlara gəlib, öz rəbləri Allah-Təalanın tərəfinə qayıdıb toplanacaqlar.**

**39) (وَالَّذِينَ كَذَّبُوا بِآيَاتِنَا صُمٌّ وَبُكْمٌ فِي الظُّلُمَاتِ) – o şəxslər ki bizim möcüzələrimizi** (Quran ayələrini) **təkzib edib, haqq sözü eşitməkdən qulaqları kar və haqq söz danışmaqdan dilləri laldır, küfr və şirk qaranlığında qalıb qaranlıqdan çıxmaq istəmirlər. (مَنْ يَشَأِ اللَّهُ يُضْلِلْهُ) – Allah-Təala kimi istəsə, onu özünün küfr və şirki səbəbi ilə zəlalətdə qoyar. (وَمَنْ يَشَأْ يَجْعَلْهُ عَلَى صِرَاطٍ مُسْتَقِيمٍ) – və Allah-Təala kimi istəsə, onu imanı səbəbi ilə düz olan yolda, haqq yolunda sabit və bərqərar edər.**

**40) (قُلْ أَرَأَيْتَكُمْ إِنْ أَتَاكُمْ عَذَابُ اللَّهِ أَوْ أَتَتْكُمُ السَّاعَةُ )** – (ey Məhəmməd), **müşriklərə de ki, mənə xəbər verin görüm, əgər dünyada Allah-Təalanın əzabı gəlib sizi tutsa, ya da qiyamət günü gəlib sizə yetişsə, əzabın qorxusundan və qiyamət gününün şiddətindən kimi çağırarsınız ki, sizə kömək olub əzabdan xilas etsin? Bəs Allah-Təalanı çağırarsınız, (أَغَيْرَ اللَّهِ تَدْعُونَ إِنْ كُنْتُمْ صَادِقِينَ) – yoxsa Allah-Təaladan başqa bütləri çağırarsınız ki, sizə kömək olsunlar? Əgər doğru deyirsinizsə, bəyan edin.**

بَلْ إِيَّاهُ تَدْعُونَ فَيَكْشِفُ مَا تَدْعُونَ إِلَيْهِ إِنْ شَاءَ وَتَنْسَوْنَ مَا تُشْرِكُونَ ﴿٤١﴾ وَلَقَدْ أَرْسَلْنَا إِلَى أُمَمٍ
مِنْ قَبْلِكَ فَأَخَذْنَاهُمْ بِالْبَأْسَاءِ وَالضَّرَّاءِ لَعَلَّهُمْ يَتَضَرَّعُونَ ﴿٤٢﴾ فَلَوْلَا إِذْ جَاءَهُمْ بَأْسُنَا تَضَرَّعُوا
وَلَكِنْ قَسَتْ قُلُوبُهُمْ وَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ مَا كَانُوا يَعْمَلُونَ ﴿٤٣﴾ فَلَمَّا نَسُوا مَا ذُكِّرُوا بِهِ فَتَحْنَا
عَلَيْهِمْ أَبْوَابَ كُلِّ شَيْءٍ حَتَّى إِذَا فَرِحُوا بِمَا أُوتُوا

---

**41)** (بَلْ إِيَّاهُ تَدْعُونَ) – (ey Məhəmməd), **onlara de ki, o vaxt heç kimi çağırmazsınız, bəlkə, Allah-Təalanı çağırarsınız,** (فَيَكْشِفُ مَا تَدْعُونَ إِلَيْهِ إِنْ شَاءَ) **– elə ki bir bəlanı sizdən dəf etməsi üçün Allah-Təalanı çağırdınız, əgər Allah-Təala özü istəsə və məsləhət görsə, o bəlanı sizdən götürər.** (وَتَنْسَوْنَ مَا تُشْرِكُونَ) **– əzab məqamında Allah-Təalaya şərik qoşduğunuz şeyləri yaddan çıxarırsınız. O vaxt yeganə olan Allah-Təaladan başqa heç bir şey yadınızda olmaz.**

**42)** (وَلَقَدْ أَرْسَلْنَا إِلَى أُمَمٍ مِنْ قَبْلِكَ) – (ey Məhəmməd), **həqiqətən, səndən əvvəlki ümmətlərə də neçə peyğəmbər göndərdik,** (Necə ki səni bu ümmətə peyğəmbər göndərdik, onları təkzib edib itaət etmədilər, necə ki sənə itaət etmirlər). (فَأَخَذْنَاهُمْ بِالْبَأْسَاءِ وَالضَّرَّاءِ) **– bu təkzib etməyin əvəzində onları qəhətlik və aclığa, pis xəstəliyə düçar etdik ki,** (لَعَلَّهُمْ يَتَضَرَّعُونَ) **– bəlkə, tövbə edib Allah-Təalanın tərəfinə qayıtsınlar.** (Ey Məhəmməd, əgər səni təkzib edənlər də tövbə edib dönməsələr, onlara da əzab göndərərəm. Məkkə əhli müşriklər tövbə etməyib küfrdən dönmədilər, Bədir savaşında Allah-Təala onlara əzab göndərib zəlil oldular).

**43)** (فَلَوْلَا إِذْ جَاءَهُمْ بَأْسُنَا تَضَرَّعُوا) – (ey Məhəmməd), **gərək, bizim əzabımız onlara gəldiyində, tövbə edib qayıdaydılar, lakin bizim tərəfimizə qayıtmadılar,** (وَلَكِنْ قَسَتْ قُلُوبُهُمْ) **– lakin onların qəlblərini sərtlik tutub, küfr və zəlalət içində qalıblar. Heç vaxt tövbə edib bizim tərəfimizə qayıdan deyillər.** (وَزَيَّنَ لَهُمُ الشَّيْطَانُ مَا كَانُوا يَعْمَلُونَ) **– şeytan onlara əməllərini süslü göstərib, öz əməllərini bəyənib, peyğəmbərlərə tabe olmayıb küfr və zəlalətlərində qaldılar.**

**44)** (فَلَمَّا نَسُوا مَا ذُكِّرُوا بِهِ) **– keçən peyğəmbərləri təkzib edən şəxslər tövbə etmələri üçün Allah-Təalanın göndərdiyi bəlaları yadlarından çıxardıb, tövbə etmədikdə,** (فَتَحْنَا عَلَيْهِمْ أَبْوَابَ كُلِّ شَيْءٍ) **– hər bir xeyir və mənfəətin qapısını onlara açıb nemətlərini bol etdik ki, bəlkə, nemət səbəbinə Allah-Təala tərəfinə qayıtsınlar.** (Necə ki mehriban atalar övladlarına bəzən qəzəblənər, bəzən lütf və mərhəmət edərlər ki, şərdən kənar olub xeyir tərəfinə yönəlsinlər. Habelə Allah-Təala da insanlarla belə rəftar edər). (حَتَّى إِذَا فَرِحُوا بِمَا أُوتُوا) **– hər bir xeyir və mənfəətin qapısını onlara açandan sonra heç bir tövbə əlaməti onlardan zahir olmadı. Ancaq o nemətlərə şad olub şadlıq-**

أَخَذْنَاهُمْ بَغْتَةً فَإِذَا هُمْ مُبْلِسُونَ ﴿٤٤﴾ فَقُطِعَ دَابِرُ الْقَوْمِ الَّذِينَ ظَلَمُوا وَالْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ
﴿٤٥﴾ قُلْ أَرَأَيْتُمْ إِنْ أَخَذَ اللَّهُ سَمْعَكُمْ وَأَبْصَارَكُمْ وَخَتَمَ عَلَى قُلُوبِكُمْ مَنْ إِلَهٌ غَيْرُ اللَّهِ يَأْتِيكُمْ
بِهِ انْظُرْ كَيْفَ نُصَرِّفُ الْآيَاتِ ثُمَّ هُمْ يَصْدِفُونَ ﴿٤٦﴾ قُلْ أَرَأَيْتَكُمْ إِنْ أَتَاكُمْ عَذَابُ اللَّهِ بَغْتَةً أَوْ
جَهْرَةً هَلْ يُهْلَكُ إِلَّا الْقَوْمُ الظَّالِمُونَ ﴿٤٧﴾ وَمَا نُرْسِلُ الْمُرْسَلِينَ إِلَّا مُبَشِّرِينَ وَمُنْذِرِينَ

---

**dan başqa heç bir şey onlardan meydana gəlmədi. Küfr və zəlalətlərində qaldılar. (أَخَذْنَاهُمْ بَغْتَةً فَإِذَا هُمْ مُبْلِسُونَ) – nemətlərini bol edəndən sonra nemət içində şad və xürrəm olduqları halda, daha da tüğyan edib Allah-Təalaya şükür etmədilər. O səbəbə görə, qəfildən onlara əzab göndərdik, əzab içində çaşqın və sərgərdan qaldılar. Allahın rəhmətindən, bütün xeyir və mənfəətlərdən binəsib olub hamısı həlak oldu.**

**45) (فَقُطِعَ دَابِرُ الْقَوْمِ الَّذِينَ ظَلَمُوا) – zalım olan cəmiyyətlər həlak olub, yer üzündən kökləri kəsilib, bir nəfər də onlardan sağ qalmadı. (وَالْحَمْدُ لِلَّهِ رَبِّ الْعَالَمِينَ) – bütün aləmlərə tərbiyə verən rəbb Allah-Təalaya həmd olsun ki, zalım olan tayfaları həlak edib yer üzünü onlardan pak etdi.** (Ayədə Allah-Təalanın özü oz müqəddəs zatına həmd etməsi insanlara bunu öyrətmək üçündür ki, zalım şəxslərin həlak olub onların şərindən xilas olmaları böyük nemətlərdən sayıldığı üçün Allah-Təalaya həmd-səna etmələri vacibdir. Bu ayə Ad və Səmud camaatının əhvalatına işarədir).

**46) (قُلْ أَرَأَيْتُمْ) –** (ey Məhəmməd)**, müşriklərə de ki, xəbər verin mənə, (إِنْ أَخَذَ اللَّهُ سَمْعَكُمْ وَأَبْصَارَكُمْ) – əgər Allah-Təala sizdən qulaqlarınızı və gözlərinizi alıb kar və kor olsanız, (وَخَتَمَ عَلَى قُلُوبِكُمْ) – və qəlblərinizə bir möhür vurub heç bir şey dərk edə bilməsəniz, (مَنْ إِلَهٌ غَيْرُ اللَّهِ يَأْتِيكُمْ بِهِ) – o zaman yeganə olan Allah-Təaladan başqa hansı ilahdır ki, bu qeyd olunan qüvvələri sizə qaytarsın?** (Əlbəttə, yoxdur, əgər olsaydı, sizin bu bütlərdən olardı, hansı ki onları Allah-Təalaya şərik qoşurdunuz). **(انْظُرْ كَيْفَ نُصَرِّفُ الْآيَاتِ) –** (ey Məhəmməd)**, bax gör ki, bu müşriklərdən ötrü tövhidə işarə edən dəlilləri necə bəyan edirik? (ثُمَّ هُمْ يَصْدِفُونَ) – dəlil aşkar olandan sonra yenə onlar etiraz edib dəlili təkzib edərlər.**

**47) (قُلْ أَرَأَيْتَكُمْ) –** (ey Məhəmməd)**, müşriklərə de ki, xəbər verin mənə, (إِنْ أَتَاكُمْ عَذَابُ اللَّهِ بَغْتَةً أَوْ جَهْرَةً) – əgər Allah-Təalanın əzabı qəfildən, bixəbər sizə yetişsə, ya da aşkar görsəniz ki, sizə əzab nazil olur, o vaxt o əzabı sizdən kim dəf edər? Heç kim dəf edə bilməz. O əzab müşriklərdən ötrüdür. (هَلْ يُهْلَكُ إِلَّا الْقَوْمُ الظَّالِمُونَ) – o əzab ilə zalım olan müşriklərdən başqası həlak olmaz.** (Siz müşriklər Allah-Təalanın əzabından qorxub itaət edin)**.**

**48) (وَمَا نُرْسِلُ الْمُرْسَلِينَ إِلَّا مُبَشِّرِينَ وَمُنْذِرِينَ) –** (ey Məhəmməd)**, biz peyğəmbərləri ancaq Allah-Təalanın rəhmətilə müjdələyən və əzabından qorxudan ola-**

فَمَنْ آمَنَ وَأَصْلَحَ فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٤٨﴾ وَالَّذِينَ كَذَّبُوا بِآيَاتِنَا يَمَسُّهُمُ الْعَذَابُ
بِمَا كَانُوا يَفْسُقُونَ ﴿٤٩﴾ قُلْ لَا أَقُولُ لَكُمْ عِنْدِي خَزَائِنُ اللَّهِ وَلَا أَعْلَمُ الْغَيْبَ وَلَا أَقُولُ لَكُمْ إِنِّي
مَلَكٌ إِنْ أَتَّبِعُ إِلَّا مَا يُوحَى إِلَيَّ قُلْ هَلْ يَسْتَوِي الْأَعْمَى وَالْبَصِيرُ أَفَلَا تَتَفَكَّرُونَ ﴿٥٠﴾ وَأَنْذِرْ بِهِ
الَّذِينَ يَخَافُونَ أَنْ يُحْشَرُوا إِلَى رَبِّهِمْ

---

**raq göndərmişik, səni də onlar kimi göndərmişik. (فَمَنْ آمَنَ وَأَصْلَحَ) – kim Allah-Təalaya iman gətirib yaxşı əməl etsə, (فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ) – belə şəxslərə qiyamət gününün əzabından qorxu yoxdur, məhzun və qəmgin də olmazlar.**

**49) (وَالَّذِينَ كَذَّبُوا بِآيَاتِنَا) – o şəxslər ki bizim Quran ayələrini təkzib edib, (يَمَسُّهُمُ الْعَذَابُ بِمَا كَانُوا يَفْسُقُونَ) – küfrlərində israr edib itaətdən çıxdıqları üçün Allah-Təalanın əzabı onlara yetişəcəkdir.**

**50) (قُلْ لَا أَقُولُ لَكُمْ عِنْدِي خَزَائِنُ اللَّهِ) –** (ey Məhəmməd),*** bu müşriklərə de ki, mən sizə demirəm və iddia etmirəm ki, Allah-Təalanın xəzinələri və insanların bütün ruziləri mənim yanımdadır, (وَلَا أَعْلَمُ الْغَيْبَ) – və mən qeyb elmini də bilmirəm. (وَلَا أَقُولُ لَكُمْ إِنِّي مَلَكٌ) – və sizə demirəm ki, həqiqətən, mən Allah-Təalanın şərəfli məxluqu olan bir mələyəm.** (Ağıldan kənar iddialar etmirəm ki, qəbul etməyəsiniz, ancaq peyğəmbərlik iddiası edirəm, necə ki məndən əvvəl peyğəmbərlər gəlib bu iddianı ediblər). **(إِنْ أَتَّبِعُ إِلَّا مَا يُوحَى إِلَيَّ) – mən ancaq o hökmlərə tabeyəm ki, Allah-Təaladan mənə vəhy olunub, o hökmləri sizə çatdırmaqla vəzifəliyəm. Daha məndən ağıldan kənar, oyunbaz əməl meydana gəlməyibdir ki, məndən kənar olub nifrət edəsiniz. (قُلْ هَلْ يَسْتَوِي الْأَعْمَى وَالْبَصِيرُ)** – (ey Məhəmməd), **müşriklərə de ki, ey ağılsız camaat, bəs kor olan şəxslə göz sahibi olub görən şəxs bərabərdirmi? (أَفَلَا تَتَفَكَّرُونَ) – heç fikirləşmirsiniz** (ki, bəlkə nicat tapasınız)?

*(****Qeyd:*** *Əgər Hz. Peyğəmbərin bu kəlmədən başqa heç bir sözü olmasaydı da, təkcə bu sözünə görə ona tabe olub itaət edilməyə layiq idi, çünki bu söz həqiqətin əsl məğzi və mahiyyətidir. Ağıl sahibləri yaxşı təfəkkür etsinlər. Kaş mən biləydim ki, bu cür açıq-aşkar olan bir ayə ilə bəzi müsəlman üləmaları olmuş və olacaq hər şeyin elminə və Allah-Təalanın xəzinələrinə sahib olmağı Hz. Peyğəmbərə necə isnad edirlər? Nəinki təkcə Hz. Peyğəmbərə, hətta xeyir sahibi imamlara və səhabələrə də bunu isnad edirlər. Ondan sonra kəşf və kəramət sahibi olduqlarını iddia edənlər özlərindən bir neçə xurafat, mövhumat düzəldib, xalq da onlara aldanıb, onları dünya və axirət işlərində ixtiyar sahibi hesab edib, onlardan şəfaət ümidi edərlər. İlahi, bu nə cəhalətdir? Bəs bu cəhalətə səbəb nədir, səbəbi müsəlmanlar arasındakı təfriqədirmi? Bu, açıq-aydın bir zəlalət və dindən çıxaraq müşriklərə qoşulmadır).*

**51) (وَأَنْذِرْ بِهِ الَّذِينَ يَخَافُونَ أَنْ يُحْشَرُوا إِلَى رَبِّهِمْ) –** (ey Məhəmməd)**, sənə vəhy olunan Quranla qiyamət günündə Allah-Təalanın tərəfinə cəm edilməkdən**

لَيْسَ لَهُمْ مِنْ دُونِهِ وَلِيٌّ وَلَا شَفِيعٌ لَعَلَّهُمْ يَتَّقُونَ ﴿٥١﴾ وَلَا تَطْرُدِ الَّذِينَ يَدْعُونَ رَبَّهُمْ بِالْغَدَاةِ
وَالْعَشِيِّ يُرِيدُونَ وَجْهَهُ مَا عَلَيْكَ مِنْ حِسَابِهِمْ مِنْ شَيْءٍ وَمَا مِنْ حِسَابِكَ عَلَيْهِمْ مِنْ شَيْءٍ فَتَطْرُدَهُمْ
فَتَكُونَ مِنَ الظَّالِمِينَ ﴿٥٢﴾ وَكَذَلِكَ فَتَنَّا بَعْضَهُمْ بِبَعْضٍ لِيَقُولُوا أَهَؤُلَاءِ مَنَّ اللَّهُ عَلَيْهِمْ مِنْ بَيْنِنَا

---

**qorxan müşrikləri qorxut ki, bəlkə, imana gələrlər. Amma qiyamətə etiqadı olmayanlara bu Quranın sözləri heç bir təsir etməyib iman gətirməzlər.** (Məkkə əhli müşriklər iki qisim idi: bəzilərinin qiyamətə etiqadları olub, bəziləri inkar edərdi)**. (**لَيْسَ لَهُمْ مِنْ دُونِهِ وَلِيٌّ وَلَا شَفِيعٌ**) – onlardan ötrü qiyamət günündə Allah-Təaladan başqa nə bir kömək olan və nə də bir şəfaət edən olmaz. (**لَعَلَّهُمْ يَتَّقُونَ**) – sən onları qorxut, bəlkə Allah-Təaladan qorxub, şirki tərk edib, müvəhhid olarlar.** (Müşriklərin rəislərindən bir neçə nəfər Hz. Peyğəmbərin hüzuruna gəlib dedilər: "Sənin hüzurunda olan bu yoxsul şəxsləri əgər özündən uzaqlaşdırsan, biz gəlib səninlə oturub danışarıq". Müşriklər yoxsul müsəlmanlarla bir yerdə oturmağı özlərinə sığışdırmayıb, narahat olurdular. Hz. Peyğəmbər buyurdu: "Bu mümkün olan şey deyil". Müşriklər dedilər: "O zaman biz sənin yanına gələndə onlar sənin yanından çıxsınlar, biz gedəndən sonra, yenə daxil olarlar". Hz. Peyğəmbər, bəlkə, onların iman etmələrinə ümid edib, bu mətləbə razı oldu. O zaman da bu sıradakı ayə nazil oldu).

**52) (**وَلَا تَطْرُدِ الَّذِينَ يَدْعُونَ رَبَّهُمْ بِالْغَدَاةِ وَالْعَشِيِّ يُرِيدُونَ وَجْهَهُ**)** – (ey Məhəmməd), **səhər-axşam öz rəbləri Allah-Təalanı çağırıb, ibadət edib, ibadətdən məqsədləri ancaq pak, müqəddəs Allah olan şəxsləri müşriklərin istəyinə görə, özündən uzaqlaşdırma, (**مَا عَلَيْكَ مِنْ حِسَابِهِمْ مِنْ شَيْءٍ**)** – (müşriklər hərçənd tənə edib deyirlər: bunlar sənə dünyəvi məqsədlərlə iman gətiriblər, amma) **onların haqq-hesabının sənə dəxli yoxdur. (**وَمَا مِنْ حِسَابِكَ عَلَيْهِمْ مِنْ شَيْءٍ**) – sənin də haqq-hesabının onlara dəxli yoxdur.** (Hamınızın hesabı Allah-Təalayadır. Amma Allah-Təala onların ixlasına şəhadət edəndən sonra heç kimin sözünün etibarı yoxdur)**. (**فَتَطْرُدَهُمْ فَتَكُونَ مِنَ الظَّالِمِينَ**) – əgər müşriklərin istəyinə görə yoxsul möminləri özündən uzaqlaşdırsan, zalımlardan olarsan.** (İslam dini hər kimin qəlbinə daxil olub, yerləşsə, o, din və millətə faydalı hesab olunar, heç vaxt ondan islam ümmətinə zərər gəlməz, yoxsul, ya da varlı, fərqi yoxdur, o şəxs islama görə mötəbər olub, bərabər hüquqlu müsəlman sayılar).

**53) (**وَكَذَلِكَ**) – müşriklərin yoxsul müsəlmanlardan sıxılmaları kimi (**فَتَنَّا بَعْضَهُمْ بِبَعْضٍ**) – müşrikləri müsəlmanlarla imtahan etdik (**لِيَقُولُوا أَهَؤُلَاءِ مَنَّ اللَّهُ عَلَيْهِمْ مِنْ بَيْنِنَا**) – ki,** (müşriklər küfr və zəlalətdə olduqlarına görə, müsəlmanlara istehza edib) **desinlər: bəs bunlardır ki, Allah-Təala minnət qoyub onları bizim aramızdan islamdan ötrü seçibdir?** (Halbuki onlar yoxsul və zəif olan

**أَلَيْسَ اللهُ بِأَعْلَمَ بِالشَّاكِرِينَ ﴿٥٣﴾ وَإِذَا جَاءَكَ الَّذِينَ يُؤْمِنُونَ بِآيَاتِنَا فَقُلْ سَلَامٌ عَلَيْكُمْ كَتَبَ رَبُّكُمْ عَلَى نَفْسِهِ الرَّحْمَةَ أَنَّهُ مَنْ عَمِلَ مِنْكُمْ سُوءًا بِجَهَالَةٍ ثُمَّ تَابَ مِنْ بَعْدِهِ وَأَصْلَحَ فَأَنَّهُ غَفُورٌ رَحِيمٌ ﴿٥٤﴾ وَكَذَلِكَ نُفَصِّلُ الْآيَاتِ وَلِتَسْتَبِينَ سَبِيلُ الْمُجْرِمِينَ ﴿٥٥﴾ قُلْ إِنِّي نُهِيتُ أَنْ أَعْبُدَ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللهِ قُلْ لَا أَتَّبِعُ أَهْوَاءَكُمْ قَدْ ضَلَلْتُ إِذًا وَمَا أَنَا مِنَ الْمُهْتَدِينَ ﴿٥٦﴾ قُلْ إِنِّي عَلَى بَيِّنَةٍ مِنْ رَبِّي وَكَذَّبْتُمْ بِهِ**

---

şəxslərdir, əgər islam dini haqq olsaydı, Allah-Təala bizə minnət qoyub bizi seçərdi. Müşriklərin cavabında Allah-Təala buyurur:) **(أَلَيْسَ اللهُ بِأَعْلَمَ بِالشَّاكِرِينَ) – bəs Allah-Təala islamdan ötrü seçmək üçün şükür edən bəndələrinə agah deyil?** (Allah-Təala bəndələrinin əhvalına agah olduğuna görə bu şəxsləri seçdi. Amma müşriklər küfr və zəlalətdə sabit qaldıqlarına görə, Allah-Təala onlardan hidayət və yardımını kəsib, zəlalət içində çaşqın və sərgərdan qaldılar).

**54) (وَإِذَا جَاءَكَ الَّذِينَ يُؤْمِنُونَ بِآيَاتِنَا)** – (ey Məhəmməd), **nə zaman sənin hüzuruna bizim Quran ayələrinə iman gətirən şəxslər gəlsələr, (فَقُلْ سَلَامٌ عَلَيْكُمْ) – onlara son dərəcə ehtiram və təvazökarlıq edib de ki, Allah-Təalanın rəhməti sizə olsun. (كَتَبَ رَبُّكُمْ عَلَى نَفْسِهِ الرَّحْمَةَ) – rəbbiniz Allah-Təala sizə rəhmət göndərməyi öz pak zatına vacib edibdir. (أَنَّهُ مَنْ عَمِلَ مِنْكُمْ سُوءًا بِجَهَالَةٍ) – Allah-Təalanın rəhməti budur, sizdən kim cahilliyi üzündən günah etsə, (ثُمَّ تَابَ مِنْ بَعْدِهِ وَأَصْلَحَ) – günahı edəndən sonra da tövbə edib yaxşı əməl etsə, Allah-Təala onun günahını bağışlayıb tövbəsini qəbul edər. (فَأَنَّهُ غَفُورٌ رَحِيمٌ) – həqiqətən, Allah-Təala tövbə edənləri bağışlayıb rəhm edəndir.**

**55) (وَكَذَلِكَ نُفَصِّلُ الْآيَاتِ وَلِتَسْتَبِينَ سَبِيلُ الْمُجْرِمِينَ)** – (ey Məhəmməd), **habelə səndən ötrü müşriklərin və günahkarların əhvalını bəyan edirik ki, onların əhvalına agah olub, getdikləri yollarından xəbərdar olasan. O zaman da hər bir şəxsin özünə görə onunla rəftar edəsən.**

**56) (قُلْ إِنِّي نُهِيتُ أَنْ أَعْبُدَ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللهِ)** – (ey Məhəmməd), **müşriklərə de ki, həqiqətən, məni Allah-Təaladan başqa ibadət etdiyiniz bütlərə ibadət etməkdən qoruyub-saxlayan və mane olan vardır** (əql dəlili mənə manedir), **(قُلْ لَا أَتَّبِعُ أَهْوَاءَكُمْ) – ey Məhəmməd, de ki, mən sizin nəfsani istəklərinizə tabe olmaram** (ki, yeganə olan Allah-Təaladan keçib sizin kimi bütlərə sitayiş edim. Əql dəlilindən keçib nəfsani istəklərə tabe olmaq aqillərin əməli deyil). **(قَدْ ضَلَلْتُ إِذًا وَمَا أَنَا مِنَ الْمُهْتَدِينَ) – əgər sizin nəfsani istəklərinizə tabe olsam, həqiqətən, o zaman sizin kimi asi olub, haqq yolundan uzaq düşüb, hidayət tapıb haqqa qovuşan şəxslərdən olmaram.**

**57) (قُلْ إِنِّي عَلَى بَيِّنَةٍ مِنْ رَبِّي)** – (ey Məhəmməd), **müşriklərə de ki, həqiqətən, Allah-Təalanı tanımaqda və ondan başqa məbudun olmamasında mənim açıq-aşkar olan dəlil və sübutum var. (وَكَذَّبْتُمْ بِهِ) – amma siz dəlil və sübutu**

مَا عِنْدِي مَا تَسْتَعْجِلُونَ بِهِ إِنِ الْحُكْمُ إِلَّا لِلَّهِ يَقُصُّ الْحَقَّ وَهُوَ خَيْرُ الْفَاصِلِينَ ﴿٥٧﴾ قُلْ لَوْ أَنَّ
عِنْدِي مَا تَسْتَعْجِلُونَ بِهِ لَقُضِيَ الْأَمْرُ بَيْنِي وَبَيْنَكُمْ وَاللَّهُ أَعْلَمُ بِالظَّالِمِينَ ﴿٥٨﴾ وَعِنْدَهُ مَفَاتِحُ
الْغَيْبِ لَا يَعْلَمُهَا إِلَّا هُوَ وَيَعْلَمُ مَا فِي الْبَرِّ وَالْبَحْرِ وَمَا تَسْقُطُ مِنْ وَرَقَةٍ إِلَّا يَعْلَمُهَا وَلَا حَبَّةٍ فِي
ظُلُمَاتِ الْأَرْضِ وَلَا رَطْبٍ وَلَا يَابِسٍ إِلَّا فِي كِتَابٍ مُبِينٍ ﴿٥٩﴾

---

**kənara qoyub, Allah-Təalanı təkzib edib ona şərik qoşursunuz. (مَا عِنْدِي مَا تَسْتَعْجِلُونَ بِهِ) – o əzabı ki, siz istəyirsiniz tezliklə sizə vaqe olsun, o əzab mənim yanımda deyil. O Allah-Təalanın yanındadır. Nə vaxt özü istəsə, əzab göndərər. (Müşriklər Hz. Peyğəmbərə deyirdilər: “Əgər sən haqq deyirsənsə, Allah-Təala səmadan bizə daş yağdırsın”. (إِنِ الْحُكْمُ إِلَّا لِلَّهِ) – əzab göndərmək ancaq Allah-Təalanın hökmündədir. (يَقُصُّ الْحَقَّ وَهُوَ خَيْرُ الْفَاصِلِينَ) – haqq söz deyənlərin və hökm edənlərin yaxşısı Allah-Təaladır.**

**58) (قُلْ لَوْ أَنَّ عِنْدِي مَا تَسْتَعْجِلُونَ بِهِ)** – (ey Məhəmməd), **de ki, həqiqətən, sizin istədiyiniz əzab mənim qüdrət və ixtiyarımda olsaydı, (لَقُضِيَ الْأَمْرُ بَيْنِي وَبَيْنَكُمْ) – sizinlə mənim aramda iş bitmiş olardı. Hökm edərdim, tamamən həlak olardınız. Sizin bu sözlərinizə səbir etməyə məndə taqət yoxdur. Amma məndə heç bir zərrə ixtiyar yoxdur, hökm və qüdrət ancaq Allah-Təalanın əlindədir. O da şəfqət qaynağıdır, sizə əzab etməkdə tələsməz. (وَاللَّهُ أَعْلَمُ بِالظَّالِمِينَ) – Allah-Təala sizin kimi zalım və müşriklərin əhvalına bizdən daha yaxşı agahdır. Zalımların cəzasını özü verəcəkdir.**

**59) (وَعِنْدَهُ مَفَاتِحُ الْغَيْبِ لَا يَعْلَمُهَا إِلَّا هُوَ) – o qeyb elmləri ki, onları bilməyə insanın yolu yoxdur, o elmlərin xəzinəsinin kilidinin açarı Allah-Təalanın yanındadır. Allah-Təaladan başqa o elmləri bilən olmaz. (وَيَعْلَمُ مَا فِي الْبَرِّ وَالْبَحْرِ) – dənizlərdə və səhralarda olan şeylərin hamısına Allah-Təala agahdır. Allah-Təalanın əcaib məxluqatına heç bir şəxs yol tapa bilməz. (وَمَا تَسْقُطُ مِنْ وَرَقَةٍ إِلَّا يَعْلَمُهَا) – ağaclardan düşən elə bir yarpaq yoxdur ki, Allah-Təala ondan agah olmasın. (وَلَا حَبَّةٍ فِي ظُلُمَاتِ الْأَرْضِ) – torpağın altında, yerin qaranlığında elə bir toxum yoxdur ki,** (və la rətbin və la yabisin illa fi kitabin mubin) **(وَلَا رَطْبٍ وَلَا يَابِسٍ إِلَّا فِي كِتَابٍ مُبِينٍ) – və elə bir yaş-quru şey yoxdur ki, ilahi elmdə - açıq-aydın kitabda sabit olmasın.** (Açıq-aydın kitab Allah-Təalanın elmidir. Allah-Təala öz elmini kitaba oxşadır. Necə ki kitabda yazılan şey həmişə qalıb, hər bir alim və oxuyan şəxsdən ötrü aşkardır, habelə bütün əşyalar da Allah-Təalanın elmində sabit və bərqərar olub ondan ötrü zahir və aşkardır. Allah-Təala bu təşbehi özündən ötrü özü zikr edir. Amma məxluqdan ötrü belə sözləri danışmaq, Allah-Təalaya təşbeh isnad etmək layiq deyil. Allah-Təala ayədə öz elminin bütün varlıqları ehtiva etdiyini bəyan edir. Məxluqatın nə həddi var ki, Allah-Təalanın pak zatının elmi müqabilində söz desin.

وَهُوَ الَّذِي يَتَوَفَّاكُمْ بِاللَّيْلِ وَيَعْلَمُ مَا جَرَحْتُمْ بِالنَّهَارِ ثُمَّ يَبْعَثُكُمْ فِيهِ لِيُقْضَى أَجَلٌ مُسَمًّى ثُمَّ إِلَيْهِ مَرْجِعُكُمْ ثُمَّ يُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٦٠﴾ وَهُوَ الْقَاهِرُ فَوْقَ عِبَادِهِ وَيُرْسِلُ عَلَيْكُمْ حَفَظَةً حَتَّى إِذَا جَاءَ أَحَدَكُمُ الْمَوْتُ تَوَفَّتْهُ رُسُلُنَا وَهُمْ لَا يُفَرِّطُونَ ﴿٦١﴾ ثُمَّ رُدُّوا إِلَى اللَّهِ مَوْلَاهُمُ الْحَقِّ أَلَا لَهُ الْحُكْمُ وَهُوَ أَسْرَعُ الْحَاسِبِينَ ﴿٦٢﴾

---

İlahi qüdrətin qarşısında cəmi məxluqatın halı, naxış iynəsi qarşısındaki gərgəfin halı kimidir. Naxış, nəqqaşın və qələmin qabağında ana rəhmində olan uşaq kimi acizdir.

Onun hər şeyi ehtiva edən elmi nə ucadır. Allah-Təala bu ayədə və bundan sonra gələn ayələrdə öz kamil qüdrətini bəyan edir).

**60) (وَهُوَ الَّذِي يَتَوَفَّاكُمْ بِاللَّيْلِ) – ey insanlar, Allah-Təala elə bir qüdrət sahibidir ki, gecələr yatanda sizi vəfat etdirib, bədənləriniz ruhsuz bədənlər kimi qalar, əgər istəsə, gecələr etdiyiniz günahlara görə, həmin halətdə sizi saxlayar, daha dünyaya qayıda bilməzsiniz. (وَيَعْلَمُ مَا جَرَحْتُمْ بِالنَّهَارِ) – və Allah-Təala gündüz etdiyiniz günahlardan da agahdır. (ثُمَّ يَبْعَثُكُمْ فِيهِ لِيُقْضَى أَجَلٌ مُسَمًّى) – gecələr günah edib, ondan sonra murdar şeylər kimi düşüb yatmaq və gündüzlər də Allah-Təalaya asi olmaq xüsusunda Allah-Təala sizi dirildəcəkdir ki, sizdən ötrü təyin edilən vaxtın tamam olmağı məlum olub sizdən haqq-hesab çəksin. (ثُمَّ إِلَيْهِ مَرْجِعُكُمْ) - diriləndən sonra hesabdan ötrü Allah-Təalanın tərəfinə toplanacaqsınız. (ثُمَّ يُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) – ondan sonra gecə-gündüz dünyada etdiyiniz əməllərinizi Allah-Təala sizə xəbər verib o əməllərinizin cəzasını sizə yetirəcəkdir.**

**61) (وَهُوَ الْقَاهِرُ فَوْقَ عِبَادِهِ) – bütün bəndələrin üstündə hakim və qalib olan Allah-Təaladır. (وَيُرْسِلُ عَلَيْكُمْ حَفَظَةً) – Allah-Təala sizə peyğəmbərlər göndərir ki, sizi pis əməllərdən qorusunlar. Nə əməl etsəniz, bizim tərəfimizdən olan peyğəmbərlər nəzarətçidirlər, (Allah-Təala insanlığı bəzən behişt vədi ilə ümidvar edir, bəzən cəhənnəmin əzabından qorxudur, gah əməllərinə nəzarət edildiyini deməklə** (halbuki özü qeybdən agahdır) **onlara xəbərdarlıq edir ki, bəlkə, zəlalətdən qurtulub, hidayət yoluna qovuşsunlar.** (حَتَّى إِذَا جَاءَ أَحَدَكُمُ الْمَوْتُ تَوَفَّتْهُ رُسُلُنَا وَهُمْ لَا يُفَرِّطُونَ) **– peyğəmbərlər sizin əməllərinizə nəzarət edərlər, elə ki sizlərdən birinə ölüm gəldi, o vaxt bizim tərəfimizdən gələn mələklər hökmü təxirə salmayıb müəyyən edilən anda o şəxsin ruhunu alıb vəfat etdirərlər.**

**62) (ثُمَّ رُدُّوا إِلَى اللَّهِ مَوْلَاهُمُ الْحَقِّ) – mələklər onları vəfat etdirəndən sonra onları haqq və ədalət üzrə işlərini idarə edən Allah-Təala tərəfinə qaytarırlar. (أَلَا لَهُ الْحُكْمُ) – xəbərdar olun ki, qiyamət günündə məxluqat arasında hökm etmək Allah-Təalaya məxsusdur. (وَهُوَ أَسْرَعُ الْحَاسِبِينَ) – haqq-hesab**

قُلْ مَنْ يُنَجِّيكُمْ مِنْ ظُلُمَاتِ الْبَرِّ وَالْبَحْرِ تَدْعُونَهُ تَضَرُّعًا وَخُفْيَةً لَئِنْ أَنْجَانَا مِنْ هَذِهِ لَنَكُونَنَّ مِنَ الشَّاكِرِينَ ﴿٦٣﴾ قُلِ اللَّهُ يُنَجِّيكُمْ مِنْهَا وَمِنْ كُلِّ كَرْبٍ ثُمَّ أَنْتُمْ تُشْرِكُونَ ﴿٦٤﴾ قُلْ هُوَ الْقَادِرُ عَلَى أَنْ يَبْعَثَ عَلَيْكُمْ عَذَابًا مِنْ فَوْقِكُمْ أَوْ مِنْ تَحْتِ أَرْجُلِكُمْ أَوْ يَلْبِسَكُمْ شِيَعًا وَيُذِيقَ بَعْضَكُمْ بَأْسَ بَعْضٍ انْظُرْ كَيْفَ نُصَرِّفُ الْآيَاتِ لَعَلَّهُمْ يَفْقَهُونَ ﴿٦٥﴾

---

**çəkənlərin hamısından sürətlə hesab çəkən Allah-Təaladır. Bir şəxsin haqq-hesabı digər şəxsi haqq-hesab etməkdə Allah-Təalaya mane olmaz.**

**63) (قُلْ مَنْ يُنَجِّيكُمْ مِنْ ظُلُمَاتِ الْبَرِّ وَالْبَحْرِ)** – (ey Məhəmməd)**, xalqa de ki, Allah-Təaladan başqa sizə bəlalardan nicat verən kimdir? (تَدْعُونَهُ تَضَرُّعًا وَخُفْيَةً)** – **bəla vaxtı son dərəcə zillətlə, həm aşkar və həm də gizlin Allah-Təalanı çağırıb deyərsiniz ki, (لَئِنْ أَنْجَانَا مِنْ هَذِهِ)** – **ilahi, əgər sən bizə bu bəladan nicat versən, (لَنَكُونَنَّ مِنَ الشَّاكِرِينَ)** – **əlbəttə, sənə şükür edən bəndələrdən olarıq.**

**64) (قُلِ اللَّهُ يُنَجِّيكُمْ مِنْهَا وَمِنْ كُلِّ كَرْبٍ)** – (ey Məhəmməd)**, de ki, o bəlalardan və bütün şiddətli və məşəqqətli müsibətlərdən Allah-Təala sizə nicat verər. Allah-Təaladan başqa nicat verən yoxdur. (ثُمَّ أَنْتُمْ تُشْرِكُونَ)** – **amma nicat tapandan sonra yenə Allah-Təalaya şərik qoşursunuz.**

**65) (قُلْ هُوَ الْقَادِرُ عَلَى أَنْ يَبْعَثَ عَلَيْكُمْ عَذَابًا مِنْ فَوْقِكُمْ أَوْ مِنْ تَحْتِ أَرْجُلِكُمْ)** – (ey Məhəmməd)**, de ki, Allah-Təala qadirdir ki, sizə səmadan,** (Necə ki Lut qövmünə və Fil əshabına – Əbrəhənin qoşununa göndərdi)**, ya da ki, ayağınız tərəfdən** (yerdən) **əzab göndərsin,** (Necə ki Nuh qövmünü tufana saldı)**. (أَوْ يَلْبِسَكُمْ شِيَعًا)** – **yenə Allah-Təala qadirdir ki, pis əməllərinizə görə siz* islam ümmətini neçə firqə, neçə qrup edib, aranıza ixtilaf salıb bir-birinizə düşmən olasınız, (وَيُذِيقَ بَعْضَكُمْ بَأْسَ بَعْضٍ)** – **zülm etdiyinizə görə, Allah-Təala qadirdir ki, sizlərdən bəzinizi digərlərinə hakim edib ona zülmünü dadızdırsın. (انْظُرْ كَيْفَ نُصَرِّفُ الْآيَاتِ)** – (ey Məhəmməd)**, bax, gör ki, bu xalqdan ötrü necə açıq-aşkar olan dəlilləri bəyan edirik ki, (لَعَلَّهُمْ يَفْقَهُونَ)** – **bəlkə, onlar anlayıb, pis əməlləri tərk edib Allah-Təalanın tərəfinə qayıtsınlar.**

(***Qeyd:** *Bu ayədə verilən xəbərin doğruluğu bizim bu zəmanəmizdə aşkardır, bax, gör, islam ümməti neçə firqə olubdur? Həmişə ədavət və kin-küdurət içindədirlər. Hər qrup o biri qrupun məzhəbini batil sayıb, özünü haqq sayır və vəhşi, canavar kimi bir-birinin canına qəsd edib, qətl etmək müsəlmanlar arasında geniş yayılıbdır, Qurani-Şərifin ehkamı müsəlmanlar arasında unudulub, hökmsüz qaldığından cəhalət müsəlmanlara qalib olub, bir-birilərinə düşmən gözüylə baxıb, islamdan kənar olublar və bu səbəbdən zəifləyiblər, halbuki bir zamanlar şərqdən qərbə dünyaya malik olmuşdular. İslam ümməti Quran ayələrinə yaxşı fikir verib, nəfsani arzularını bir kənara qoyub Qurani-Şərifə gərək tabe olsunlar. Bu xəbərin təsdiq olunması Hz. Peyğəmbərin haqq olduğuna böyük dəlildir).*

وَكَذَّبَ بِهِ قَوْمُكَ وَهُوَ الْحَقُّ قُلْ لَسْتُ عَلَيْكُمْ بِوَكِيلٍ ﴿٦٦﴾ لِكُلِّ نَبَإٍ مُسْتَقَرٌّ وَسَوْفَ تَعْلَمُونَ
﴿٦٧﴾ وَإِذَا رَأَيْتَ الَّذِينَ يَخُوضُونَ فِي آيَاتِنَا فَأَعْرِضْ عَنْهُمْ حَتَّى يَخُوضُوا فِي حَدِيثٍ غَيْرِهِ وَإِمَّا
يُنْسِيَنَّكَ الشَّيْطَانُ فَلَا تَقْعُدْ بَعْدَ الذِّكْرَى مَعَ الْقَوْمِ الظَّالِمِينَ ﴿٦٨﴾ وَمَا عَلَى الَّذِينَ يَتَّقُونَ مِنْ حِسَابِهِمْ
مِنْ شَيْءٍ وَلَكِنْ ذِكْرَى لَعَلَّهُمْ يَتَّقُونَ ﴿٦٩﴾ وَذَرِ الَّذِينَ اتَّخَذُوا دِينَهُمْ لَعِبًا وَلَهْوًا وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا

---

**66) (وَكَذَّبَ بِهِ قَوْمُكَ وَهُوَ الْحَقُّ)** – (ey Məhəmməd), **sənin qövmün** (Qüreyş) **camaatı müşriklərə əzab nazil olduğunu təkzib etdilər, halbuki haqdır, onlara əzab nazil olmaqda heç bir şübhə yoxdur,** (Necə ki Bədirdə Qüreyşə əzab nazil oldu), **(قُلْ لَسْتُ عَلَيْكُمْ بِوَكِيلٍ)** – (ey Məhəmməd), **de ki, mən sizə vəkil deyiləm ki, zorla təkzib etməyi sizə qadağan edim?**

**67) (لِكُلِّ نَبَإٍ مُسْتَقَرٌّ) – Qurani-Şərifdə sizə verilən hər bir xəbərin müəyyən bir vaxtı vardır, o vaxt da gecikmədən o xəbər mütləq vaqe olacaqdır, (o xəbərlərdən biri də əzab xəbəridir, öz vaxtında vaqe olacaqdır. Bədir savaşında vaxtı yetişib vaqe oldu). (وَسَوْفَ تَعْلَمُونَ) – əzabın vaxtı yetişəndə tezliklə bu xəbərin doğruluğu sizə məlum olar, bilərsiniz ki, əzab var, yox-sa yox?** (Məkkədə Qüreyş camaatının məclislərində Hz. Peyğəmbər Quran oxuyanda ona tənə edib, istehza edirdilər. Sıradakı ayədə Hz. Peyğəmbərə belə vaxtlarda onların məclisinə daxil olub oturub Quran oxumaq qadağan edilir).

**68) (وَإِذَا رَأَيْتَ الَّذِينَ يَخُوضُونَ فِي آيَاتِنَا)** – (ey Məhəmməd), **nə zaman ki Qüreyş camaatının bizim ayələrimizə istehza edib tənə etdiyini gördün, (فَأَعْرِضْ عَنْهُمْ حَتَّى يَخُوضُوا فِي حَدِيثٍ غَيْرِهِ) – o zaman üz döndərib, onların məclisindən çıx ki, Qurandan başqa sözlərlə məşğul olsunlar. (وَإِمَّا يُنْسِيَنَّكَ الشَّيْطَانُ)** – (ey Məhəmməd), **əgər şeytan Qurana istehza edilən vaxt Allah-Təalanın sənə onların məclisinə daxil olmağı qadağan etdiyini yadından çıxardıb, daxil olsan,** (nəfsin etdiyi hər bir pis əməl şeytana isnad edilir), **(فَلَا تَقْعُدْ بَعْدَ الذِّكْرَى مَعَ الْقَوْمِ الظَّالِمِينَ) – Allah-Təalanın qadağan etməsi yadına düşəndən sonra zalım olan camaatla bir yerdə oturma və onların məclisinə daxil olma.**

**69) (وَمَا عَلَى الَّذِينَ يَتَّقُونَ مِنْ حِسَابِهِمْ مِنْ شَيْءٍ) – müttəqi olan şəxslərə müşriklərin hesabından və günahından heç bir şey yoxdur, onlara bir zərər aid ol-maz. Günahlarının cəzası özlərinə yetişəcəkdir. (وَلَكِنْ ذِكْرَى لَعَلَّهُمْ يَتَّقُونَ) – la-kin müttəqilərə lazım olan onlara öyüd-nəsihət etməkdir ki, bəlkə, iman gətirib müttəqilərin sırasına daxil olsunlar.**

**70) (وَذَرِ الَّذِينَ اتَّخَذُوا دِينَهُمْ لَعِبًا وَلَهْوًا)** – (ey Məhəmməd), **o müşriklər ki, islamı oyun, əyləncə sayıb, ona istehza edirlər, hansı ki islam dini onlardan ötrü göndərilibdir, belə şəxsləri tərk edib onlara etina etmə. (وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا) – dünya həyatı onları məğrur edib, aldadıb nəfsani istəklərə tabe olub haqq**

وَذَكِّرْ بِهِ أَنْ تُبْسَلَ نَفْسٌ بِمَا كَسَبَتْ لَيْسَ لَهَا مِنْ دُونِ اللَّهِ وَلِيٌّ وَلَا شَفِيعٌ وَإِنْ تَعْدِلْ كُلَّ عَدْلٍ لَا يُؤْخَذْ مِنْهَا أُولَئِكَ الَّذِينَ أُبْسِلُوا بِمَا كَسَبُوا لَهُمْ شَرَابٌ مِنْ حَمِيمٍ وَعَذَابٌ أَلِيمٌ بِمَا كَانُوا يَكْفُرُونَ ﴿٧٠﴾ قُلْ أَنَدْعُو مِنْ دُونِ اللَّهِ مَا لَا يَنْفَعُنَا وَلَا يَضُرُّنَا وَنُرَدُّ عَلَى أَعْقَابِنَا بَعْدَ إِذْ هَدَانَا اللَّهُ كَالَّذِي اسْتَهْوَتْهُ الشَّيَاطِينُ فِي الْأَرْضِ حَيْرَانَ لَهُ أَصْحَابٌ يَدْعُونَهُ إِلَى الْهُدَى ائْتِنَا قُلْ إِنَّ هُدَى اللَّهِ هُوَ الْهُدَى وَأُمِرْنَا لِنُسْلِمَ لِرَبِّ الْعَالَمِينَ ﴿٧١﴾

---

**dini tərk ediblər. (**وَذَكِّرْ بِهِ أَنْ تُبْسَلَ نَفْسٌ بِمَا كَسَبَتْ**)** – (ey Məhəmməd)**, bu Quranla asilərə öyüd-nəsihət et ki günahkar şəxslər qazandıqları əməlləri səbəbi ilə həlak olub, ilahi əzaba düçar olmasınlar. (**لَيْسَ لَهَا مِنْ دُونِ اللَّهِ وَلِيٌّ وَلَا شَفِيعٌ**) – Allah-Təaladan başqa onların işlərini idarə edən və onlardan ötrü şəfaət edən yoxdur. (**وَإِنْ تَعْدِلْ كُلَّ عَدْلٍ لَا يُؤْخَذْ مِنْهَا**) – əgər qiyamət günündə hər kəs özündən ötrü nə fidyə versə ki, ona əzab olunmasın, yenə ondan qəbul olunmaz, (halbuki mümkün deyil, fidyə tapa bilməzlər). (**أُولَئِكَ الَّذِينَ أُبْسِلُوا بِمَا كَسَبُوا**) – islam dinini oyun, əyləncə sayıb, istehza edənlər qiyamət günündə qazandıqları əməlləri səbəbi ilə əzaba düçar olarlar. (**لَهُمْ شَرَابٌ مِنْ حَمِيمٍ**) – onlardan ötrü içməyə son dərəcə qaynar su vardır. (**وَعَذَابٌ أَلِيمٌ بِمَا كَانُوا يَكْفُرُونَ**) – o səbəbə görə ki, Allah-Təalanın Quranını inkar etdilər. Onlardan ötrü şiddətli əzab vardır.**

**71) (**قُلْ أَنَدْعُو مِنْ دُونِ اللَّهِ مَا لَا يَنْفَعُنَا وَلَا يَضُرُّنَا**)** – (ey Məhəmməd)**, müşriklərə de ki, bəs layiqdir ki, Allah-Təaladan başqasına, bizə nə mənfəət, nə də zərər verə bilməyən o bütlərə ibadət edək? (**وَنُرَدُّ عَلَى أَعْقَابِنَا بَعْدَ إِذْ هَدَانَا اللَّهُ**) – bəs bu layiqdir ki, Allah-Təala bizi islama hidayət edəndən sonra ondan dönüb, yenə müşrik olaq? (**كَالَّذِي اسْتَهْوَتْهُ الشَّيَاطِينُ فِي الْأَرْضِ حَيْرَانَ**) – o şəxs kimi* olaq ki, şeytanlar onu düz yoldan kənara salıb biyabanda sərgərdan qalıb? (**لَهُ أَصْحَابٌ يَدْعُونَهُ إِلَى الْهُدَى ائْتِنَا**) – halbuki o şəxsin yola bələd olan yoldaşları olub, o şəxsi çağırıb deyirdilər ki, bizim tərəfimizə gəl, yola bələdik. Bizdən kənar olma. Biyabanda həlak olarsan. O şəxs yoldaşlarının sözünə qulaq asmayıb, şeytana tabe olub biyabanda həlak oldu. (Ey müşriklər, istəyirsiniz, biz də bu şəxs kimi olaq? Allah-Təalanın Quranını qoyub siz şeytanlara tabe olub, zəlalət səhrasında həlak olaq?) (**قُلْ إِنَّ هُدَى اللَّهِ هُوَ الْهُدَى**) –** (ey Məhəmməd)**, de ki, həqiqətən, haqq olan hidayət, Allah-Təala hidayəti islam dinindədir. Ondan kənara düşən zəlalətdədir. (**وَأُمِرْنَا لِنُسْلِمَ لِرَبِّ الْعَالَمِينَ**) – əmr olunmuşuq ki, bütün aləmlərə tərbiyə verən yeganə rəbb Allah-Təalaya itaət edək.** (Tövhidi əmr edən ağıldır. Neçə dəfə bu mətləbə işarə olunubdur. Çünki ağıl Allahı bilmədə təkbaşına kifayət edər. Peyğəmbərlər isə xalqı qəflətdən oyatmaqdan ötrü lazımdır. Ağıl sahiblərinin diqqət etməsi tövsiyə edilir).

وَأَنْ أَقِيمُوا الصَّلَاةَ وَاتَّقُوهُ وَهُوَ الَّذِي إِلَيْهِ تُحْشَرُونَ ﴿٧٢﴾ وَهُوَ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ بِالْحَقِّ وَيَوْمَ يَقُولُ كُنْ فَيَكُونُ قَوْلُهُ الْحَقُّ وَلَهُ الْمُلْكُ يَوْمَ يُنْفَخُ فِي الصُّورِ عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ وَهُوَ الْحَكِيمُ الْخَبِيرُ ﴿٧٣﴾ وَإِذْ قَالَ إِبْرَاهِيمُ لِأَبِيهِ آزَرَ أَتَتَّخِذُ أَصْنَامًا آلِهَةً

---

*(*___Qeyd:___ Bu məsəl ərəblərin etiqadına görədir, ərəblərə görə - cin və şeytan, qulyabanılar insana çöllərdə, biyabanlarda hakim olub düz yoldan onu çıxarıb, həlak edərlər. Bundan ötrü bəzi mənasız hekayələr və xurafat sözlər nəql ediblər. Allah-Təala Qurani-Şərifində insanın adəti üzrə danışdığına görə, ərəblərin öz aralarında adət olan məsəl və hekayələrlə əsl həqiqi mətləbi onlara bildirir, əsli və həqiqəti olmayan şeyi məsəl kimi qeyd etməkdə heç bir maneə yoxdur. Bu, örf və adətdə olan şeydir. Ya da ki Allah-Təala müşriklərin özlərini şeytan sayıb, onların azdırması ilə asi olanları biyabanda yoldaşlarından kənara düşüb çaşqın və sərgərdan qalıb həlak olan şəxslərə oxşadır. Diqqət edilsin).*

**72) (وَأَنْ أَقِيمُوا الصَّلَاةَ وَاتَّقُوهُ) – yenə Allah-Təala bizə əmr buyurubdur ki, namaz qılın, Allah-Təaladan qorxub namazı tərk etməyin. (وَهُوَ الَّذِي إِلَيْهِ تُحْشَرُونَ) – tamamən Allah-Təala tərəfinə haqq-hesabdan ötrü toplanacaqsınız.**

**73) (وَهُوَ الَّذِي خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ بِالْحَقِّ) – səmaları və yeri haqq və hikmət üzrə yaradan Allah-Təaladır. (وَيَوْمَ يَقُولُ كُنْ فَيَكُونُ) – Allah-Təala nə zaman bir şeyə ol desə, o şey o anda mövcud olar.** (“ol” sözü Allah-Təalanın iradəsindən, istəyindən ibarətdir. Allah-Təala nə zaman bir şeyin olmasını istəsə, o şey mövcud olar, “ol” sözünə ehtiyacı yoxdur)**. (قَوْلُهُ الْحَقُّ) – Allah-Təalanın sözü və fərmanı tamamən haqq və hikmətdir. Hər bir məxluq ancaq hikmət üzrə dünyaya gələr. (وَلَهُ الْمُلْكُ يَوْمَ يُنْفَخُ فِي الصُّورِ) – məhv olan surətlərə* ruh üflənib, hamısı dirilib, məhşərdə hazır olan gündə də səltənət və padşahlıq Allah-Təalaya məxsusdur, (عَالِمُ الْغَيْبِ وَالشَّهَادَةِ) – qeybə və aşkara agah olan da Allah-Təaladır. (وَهُوَ الْحَكِيمُ الْخَبِيرُ) – Allah-Təala bütün əməllərində hikmət sahibidir, xalqın etdiyi xeyir və şər əməllərə agah və xəbərdardır.**

*(*___Qeyd:___ Sur – surətin cəmidir, surdan məqsəd bədənlərin surətidir ki, dağılıb məhv olublar. Onlara ruh üflənməklə yenidən dirilərlər. Nəhv alimlərindən Əbu Übeydə və təfsirçilərdən Həsən əl-Bəsri və Müqatil belə deyibdir. Sur barəsində başqa mənasız sözlər də deyilib. Onları qeyd etmək layiq deyildir).*

**74) (وَإِذْ قَالَ إِبْرَاهِيمُ لِأَبِيهِ آزَرَ)** – (ey Məhəmməd)**, xalqa İbrahimin əhvalatını bəyan et, o zaman ki atası** (Azərə) **dedi: “(أَتَتَّخِذُ أَصْنَامًا آلِهَةً) – Ey ata, bütləri özünə tanrı* və məbud qəbul edirsən?**

*(*___Qeyd:___ Hz. İbrahimin atası Azər büt düzəldən idi. Uşaqlıq vaxtı Hz. İbrahimə verərdi ki, apar sat. Hz. İbrahim aparıb bazarda deyərdi: “Zərər və mənfəət verməyən*

إِنِّي أَرَاكَ وَقَوْمَكَ فِي ضَلَالٍ مُبِينٍ ﴿٧٤﴾ وَكَذَلِكَ نُرِي إِبْرَاهِيمَ مَلَكُوتَ السَّمَاوَاتِ وَالْأَرْضِ
وَلِيَكُونَ مِنَ الْمُوقِنِينَ ﴿٧٥﴾ فَلَمَّا جَنَّ عَلَيْهِ اللَّيْلُ رَأَى كَوْكَبًا قَالَ هَذَا رَبِّي فَلَمَّا أَفَلَ قَالَ لَا أُحِبُّ
الْآفِلِينَ ﴿٧٦﴾

---

*bu şeyi kim alar?" Ondan sonra bütləri su kənarına apparardı, onları suyun içinə salıb deyərdi: "Su için". Elə ki camaat onun bu hərəkətini gördü, uşaqlıqdan onunla ədavət saxlamağa başladılar. 16 yaşında peyğəmbərliklə vəzifələnib, onları imana dəvət etdi. Heç bir nəfər köməyi yox idi. Hətta atası ona son dərəcə düşmən olub tək, yalqız müşriklərin qarşısında durub, Allah-Təalanın hökmünü yaydı).*

**(إِنِّي أَرَاكَ وَقَوْمَكَ فِي ضَلَالٍ مُبِينٍ) – Ey ata, həqiqətən, mən səni və qövmünü aşkar olan zəlalətdə görürəm".** (Yeganə olan Allah-Təalanı qoyub bütə sitayiş edirsiniz)**.**

**75) (وَكَذَلِكَ نُرِي إِبْرَاهِيمَ مَلَكُوتَ السَّمَاوَاتِ وَالْأَرْضِ) – necə ki İbrahimi bəsirət sahibi edib atasının və qövmünün zəlalətdə olduğunu ona bildirdik, habelə Allahın səmalarda və yerdə olan səltənətini və kamil qüdrətini ona göstərib zəlalət pərdəsini onun təmiz qəlbindən açıb götürdük ki, mühakimə yoluyla hidayət tapıb Allah-Təalanın vəhdaniyyətini dəlil üzrə isbat etdi. (وَلِيَكُونَ مِنَ الْمُوقِنِينَ) – Hz. İbrahimin bəsirətini açdıq ki, Allah-Təalanın vəhdaniyyətinə tam inanan şəxslərdən olsun.** (Hz. İbrahimin qövmü bütpərəst idi, bəzisi də günəşə, aya və ulduzlara sitayiş edirdilər. Hz. İbrahim istədi ki, onların din və məzhəblərində xətalarını ağıl yoluyla onlara bəyan edib bildirsin.Yəni bu şeylər ki, ibadət edirsiniz, heç birisi ibadətə və məbud olmağa layiq deyildir. Çünki o şeylərin hamısının sonradan yaradıldığı, məxluq olduğu aşkardır. Məxluq məbud ola bilməz. Məxluqatı bir yaradan lazımdır. O yaradan da mütləq qüdrət sahibi və yeganə məbud olan Allahdır ki, bütün zərrələrin və kainatın idarəsi o pak, müqəddəs zata bağlıdır, bu səbəbdən gələn ayədə qeyd olunan dəlillər üzrə onların dinini batil edib, həqiqi və şəriksiz məbud olan yeganə Allah-Təalaya sitayiş edilməsinin vacibliyini isbat edir. İndi bu ayənin təfsirinə başlayaq).

**76) (فَلَمَّا جَنَّ عَلَيْهِ اللَّيْلُ رَأَى كَوْكَبًا قَالَ هَذَا رَبِّي فَلَمَّا أَفَلَ قَالَ لَا أُحِبُّ الْآفِلِينَ) – gecə* vaxtı olub ulduzlar zahir oldu,**

*(***Qeyd:** Bu əhvalat Hz. İbrahimin peyğəmbərliyinin əvvəlində vaqe olubdur).*

**Hz. İbrahim, ulduzu** (Zöhrə) **gördü, hansı ki qövmü ona sitayiş edirdi. Onların dinini dəlil üzrə batil etməkdən ötrü o da onlara qarışıb onlar deyən sözü dedi: "Mənim rəbbim və məbudum** (Zöhrə) **ulduzudur,** (Necə ki siz deyirsiniz, mən də ona sitayiş edirəm". Ondan sonra gözləyib gördü ki, Zöhrə qürub etdi. Ondan sonra geri qayıtdı ki, onların dininin batil olduğunu bəyan etsin. Dedi: "Bir məbud ki, dəyişib, bir haldan digər bir hala və bir məkandan

فَلَمَّا رَأَى الْقَمَرَ بَازِغًا قَالَ هَذَا رَبِّي فَلَمَّا أَفَلَ قَالَ لَئِنْ لَمْ يَهْدِنِي رَبِّي لَأَكُونَنَّ مِنَ الْقَوْمِ الضَّالِّينَ ﴿٧٧﴾ فَلَمَّا رَأَى الشَّمْسَ بَازِغَةً قَالَ هَذَا رَبِّي هَذَا أَكْبَرُ فَلَمَّا أَفَلَتْ قَالَ يَا قَوْمِ إِنِّي بَرِيءٌ مِمَّا تُشْرِكُونَ ﴿٧٨﴾ إِنِّي وَجَّهْتُ وَجْهِيَ لِلَّذِي فَطَرَ السَّمَاوَاتِ وَالْأَرْضَ حَنِيفًا وَمَا أَنَا مِنَ الْمُشْرِكِينَ ﴿٧٩﴾

---

digər bir məkana keçsin, bəzən zahir olub, bəzən pərdə arxasına keçsin, belə məbuda ibadət etmək istəmərəm, mənə belə məbud lazım deyildir”).

**77) (فَلَمَّا رَأَى الْقَمَرَ بَازِغًا)** – (ondan sonra Hz. İbrahim dayanıb gözlədi ki, ay doğdu, aya səcdə edənlər səcdəyə düşüb sitayiş etdilər)**, elə ki Hz. İbrahim ayın doğduğunu gördü, (قَالَ هَذَا رَبِّي) – dedi: “Budur mənim rəbbim və məbudum,”** (Zöhrə deyil. Necə ki aya sitayiş edənlər dedilər, Hz. İbrahim də onlar kimi dedi: “Mən də sizin kimi qəbul etdim, bəs görün belə şey rəbb və məbud olmağa layiqdir, yoxsa yox?”) **(فَلَمَّا أَفَلَ) – elə ki ay da ulduz kimi batdı, (قَالَ لَئِنْ لَمْ يَهْدِنِي رَبِّي لَأَكُونَنَّ مِنَ الْقَوْمِ الضَّالِّينَ) – dedi: “Ağıllı şəxs də bu ulduza sitayiş edərmi? Bu da əvvəlki kimi bir ulduzdur. Onun kimi batdı. Aqil şəxs belə şeylərə necə sitayiş edər? Əgər Allah-Təala məni öz sitayişində sabitqədəm etməsə, əlbəttə mən də sizin kimi asi və haqdan kənara düşən camaatdan olaram”.**

**78) (فَلَمَّا رَأَى الشَّمْسَ بَازِغَةً) – Hz. İbrahim elə ki günəşin doğduğunu gördü,** (günə sitayiş edənlər sitayiş etdilər), **(قَالَ هَذَا رَبِّي هَذَا أَكْبَرُ) – Hz. İbrahim onlara qarışıb onlar kimi dedi: “Budur mənim rəbbim və məbudum. Bu özü də onlardan böyük və nuranidir. İbadət edilməyə bu layiqdir”. (فَلَمَّا أَفَلَتْ) – elə ki günəş də batdı, Hz. İbrahim dedi: “Ey qövm, bu da onlar kimi qeyb oldu, bunların heç biri ibadət edilməyə layiq deyildir, çünki bunların seyr və hərəkətindən məlum oldu ki, məxluqdurlar. Məxluq olan şey necə məbud olar, halbuki məxluqun özünün Xaliqə ehtiyacı var. Belə şeyləri Allah-Təalaya şərik qoşmaq, ya da ona Allah demək layiqdirmi?”) (قَالَ يَا قَوْمِ إِنِّي بَرِيءٌ مِمَّا تُشْرِكُونَ) – İbrahim dedi: “Ey qövm, həqiqətən, mən sizin Allaha şərik qoşduqlarınızdan uzağam”.**

**79) (إِنِّي وَجَّهْتُ وَجْهِيَ لِلَّذِي فَطَرَ السَّمَاوَاتِ وَالْأَرْضَ)** – (elə ki Hz. İbrahim onların dinlərini dəlil üzrə batil etdi, ondan sonra yeganə olan Allah-Təalaya sitayiş etməyin vacib olduğunu bəyan etməkdən ötrü buyurur:) **həqiqətən, mən üzümü bu şeylərdən ibadət məqamında yeganə olan, səmaları və yeri yaradıb, yoxdan yaradan Allah-Təalaya çevirdim. (حَنِيفًا) – bütün batil olan şeylərin ibadətindən keçib bir olan Allah-Təalaya ibadət edirəm. (وَمَا أَنَا مِنَ الْمُشْرِكِينَ) – əlbəttə, mən sizin kimi Allah-Təalaya şərik qoşanlardan deyiləm.**

وَحَاجَّهُ قَوْمُهُ قَالَ أَتُحَاجُّونِّي فِي اللهِ وَقَدْ هَدَانِ وَلَا أَخَافُ مَا تُشْرِكُونَ بِهِ إِلَّا أَنْ يَشَاءَ رَبِّي شَيْئًا
وَسِعَ رَبِّي كُلَّ شَيْءٍ عِلْمًا أَفَلَا تَتَذَكَّرُونَ ﴿٨٠﴾ وَكَيْفَ أَخَافُ مَا أَشْرَكْتُمْ وَلَا تَخَافُونَ أَنَّكُمْ
أَشْرَكْتُمْ بِاللهِ مَا لَمْ يُنَزِّلْ بِهِ عَلَيْكُمْ سُلْطَانًا فَأَيُّ الْفَرِيقَيْنِ أَحَقُّ بِالْأَمْنِ إِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿٨١﴾
الَّذِينَ آمَنُوا وَلَمْ يَلْبِسُوا إِيمَانَهُمْ بِظُلْمٍ أُولَئِكَ لَهُمُ الْأَمْنُ وَهُمْ مُهْتَدُونَ ﴿٨٢﴾

---

**80) (وَحَاجَّهُ قَوْمُهُ) – elə ki Hz. İbrahim qövmünün dinini batil etdi, onunla mübahisə və münaqişəyə girişib, tövhidi qəbul etmədilər. (قَالَ أَتُحَاجُّونِّي فِي اللهِ وَقَدْ هَدَانِ) – Hz. İbrahim dedi: "Siz nə qədər idraksız bir camaatsınız, Allah-Təala məni öz tövhidinə hidayət edib, mən Allah-Təalanı vahid, şəriksiz bilərkən, siz mənimlə münaqişə və mübahisə edirsiniz?"** (Müşriklər Hz. İbrahimi öz məbudları ilə qorxudub deyirdilər: "Onların haqqında nalayiq sözlər demə, sənə zərər yetirərlər". Onların cavabında buyurur:) (وَلَا أَخَافُ مَا تُشْرِكُونَ بِهِ إِلَّا أَنْ يَشَاءَ رَبِّي شَيْئًا) – **o şeyləri ki, Allah-Təalaya şərik qoşursunuz, mənim onlardan qorxum yoxdur (ki, mənə zərər yetirsinlər, çünki onlar heç bir zərər yetirməyə qadir deyillər). Ancaq mənim rəbbim Allah-Təala bir zərər yetirmək istəsə, o vaxt mən qorxaram.** (Çünki mənim rəbbim zərər və mənfəət yetirməyə qadirdir). **(وَسِعَ رَبِّي كُلَّ شَيْءٍ عِلْمًا)** – (və zərər yetirməyə qadir olması təəccüblü deyil)**. Çünki mənim rəbbim Allah-Təalanın elmi bütün şeyləri ehtiva edər.** (Hər bir şeyə agah olan şəxs onları istədiyi kimi idarə etməyə də qadir olar). **(أَفَلَا تَتَذَكَّرُونَ) – bəs fikir vermirsiniz ki, qüdrətli olanla aciz arasında fərq qoyasınız?**

**81) (وَكَيْفَ أَخَافُ مَا أَشْرَكْتُمْ) – o şeyləri ki, siz Allah-Təalaya şərik qoşursunuz, mən onlardan necə qorxum? Halbuki onlardan heç bir zərər gəlməz. (وَلَا تَخَافُونَ أَنَّكُمْ أَشْرَكْتُمْ بِاللهِ مَا لَمْ يُنَزِّلْ بِهِ عَلَيْكُمْ سُلْطَانًا) – halbuki siz qorxmayıb Allah-Təalaya o şeyləri şərik qoşursunuz ki, Allah-Təala onların şərik olması haqda heç bir dəlil göndərməyibdir.** (Çünki hər bir şeyə gərək Allah-Təaladan dəlil olsun. Əgər onlar Allah-Təalaya şərik olsalar, gərək, Allah-Təala onların haqqında bir dəlil göndərsin. Necə ola bilər ki, Allah-Təala özündən ötrü şərik təyin etsin? Siz belə bir şeydən qorxmursunuzsa, mən niyə sizin bütlərdən qorxum, heç qorxunc deyildirlər). **(فَأَيُّ الْفَرِيقَيْنِ أَحَقُّ بِالْأَمْنِ إِنْ كُنْتُمْ تَعْلَمُونَ) – bəs iki firqənin** (müşriklə müvəhhidin) **hansı biri əmin-amanlıqda olub xatircəm olmağa layiqdir? Əgər elm sahibisinizsə, bəyan edin.** (Sizdə nə elm, nə də fərasət vardır ki, müşriklə müvəhhid arasında fərq qoyasınız, əgər fərq qoyan olsaydınız, müşrik olmazdınız).

**82) (الَّذِينَ آمَنُوا وَلَمْ يَلْبِسُوا إِيمَانَهُمْ بِظُلْمٍ) – o şəxslər ki Allah-Təalaya iman gətirib imanlarını Allah-Təalaya şərik* qoşmaqla bulaşdırmayıblar, (أُولَئِكَ لَهُمُ الْأَمْنُ وَهُمْ مُهْتَدُونَ) – Allah-Təalanın əzabından əmin-amanlıqda olub**

وَتِلْكَ حُجَّتُنَا آتَيْنَاهَا إِبْرَاهِيمَ عَلَى قَوْمِهِ نَرْفَعُ دَرَجَاتٍ مَنْ نَشَاءُ إِنَّ رَبَّكَ حَكِيمٌ عَلِيمٌ ﴿٨٣﴾
وَوَهَبْنَا لَهُ إِسْحَاقَ وَيَعْقُوبَ كُلًّا هَدَيْنَا وَنُوحًا هَدَيْنَا مِنْ قَبْلُ وَمِنْ ذُرِّيَّتِهِ دَاوُودَ وَسُلَيْمَانَ وَأَيُّوبَ
وَيُوسُفَ وَمُوسَى وَهَارُونَ وَكَذَلِكَ نَجْزِي الْمُحْسِنِينَ ﴿٨٤﴾ وَزَكَرِيَّا وَيَحْيَى وَعِيسَى وَإِلْيَاسَ
كُلٌّ مِنَ الصَّالِحِينَ ﴿٨٥﴾ وَإِسْمَاعِيلَ وَالْيَسَعَ وَيُونُسَ وَلُوطًا وَكُلًّا فَضَّلْنَا عَلَى الْعَالَمِينَ ﴿٨٦﴾

---

**xatircəm olmaq o şəxslərdən ötrüdür, nəinki sizin kimi müşriklərdən ötrü və həqiqət yoluna da hidayət tapan onlardırlar.**

*(*Qeyd:* *Allah-Təalaya şərik qoşmaq böyük zülmdür, şirkdən böyük hansı zülm var? Necə ki Loğman oğluna nəsihət edib deyir: "Ey oğul, Allah-Təalaya şərik qoşma, Allah-Təalaya şərik qoşmaq böyük zülmdür". İnşallah Loğman surəsində qeyd olunacaqdır).*

**83) (وَتِلْكَ حُجَّتُنَا آتَيْنَاهَا إِبْرَاهِيمَ عَلَى قَوْمِهِ) – bu qeyd olunan dəlillər bizim dəlillərimizdir. Onları İbrahimə bəxş etdik.** (Bu dəlillər ağıl vasitəsilə Hz. İbrahimə verilmişdi ki, onlarla dəlil gətirib qövmünə qalib olsun. O səbəbdən Hz. İbrahimin dərəcəsini ucaltdıq, halbuki o da həmin qövm və camaatdan idi). **(نَرْفَعُ دَرَجَاتٍ مَنْ نَشَاءُ) – kimi istəsək, onun dərəcəsini elm və hikmətdə ucaldıb onu başqalarına üstün edərik. Necə ki Hz. İbrahimi üstün etdik. (إِنَّ رَبَّكَ حَكِيمٌ عَلِيمٌ)** – (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin hər bir elmdə hikmət sahibi və xalqın əməllərinə agahdır.**

**84) (وَوَهَبْنَا لَهُ إِسْحَاقَ وَيَعْقُوبَ كُلًّا هَدَيْنَا) – və Hz. İbrahimə oğlu İshaqı və onun oğlu* Yaqubu bəxş etdik, onları haqq yoluna hidayət edib, hər birinə peyğəmbərlik verdik.**

*(*Qeyd:* *Yaqub İshaq oğlu Hz. İbrahimin sağlığında dünyaya gəlibdir).*

**(وَنُوحًا هَدَيْنَا مِنْ قَبْلُ) – və Nuhu da Hz. İbrahimdən əvvəl haqq yoluna hidayət edib, ona peyğəmbərlik verdik.** (və min zurriyyətihi Davudə və Süleymanə və Eyyubə və Yusufə və Musa və Harunə) (وَمِنْ ذُرِّيَّتِهِ دَاوُودَ وَسُلَيْمَانَ وَأَيُّوبَ وَيُوسُفَ وَمُوسَى وَهَارُونَ) **– və yenə Hz. İbrahimin nəslindən qeyd olunan peyğəmbərləri haqq tərəfinə hidayət etdik, (وَكَذَلِكَ نَجْزِي الْمُحْسِنِينَ) – habelə yaxşı əməl edən şəxslərə mükafat verib, onları da haqq tərəfinə hidayət etdik.**

**85)** (وَزَكَرِيَّا وَيَحْيَى وَعِيسَى وَإِلْيَاسَ كُلٌّ مِنَ الصَّالِحِينَ) **– və yenə Hz. İbrahimin nəslindən olan Zəkəriyya, Yəhya, İsa və İlyas peyğəmbəri haqq tərəfinə hidayət etdik. Hər biri də saleh olan şəxs idi.**

**86)** (وَإِسْمَاعِيلَ وَالْيَسَعَ وَيُونُسَ وَلُوطًا وَكُلًّا فَضَّلْنَا عَلَى الْعَالَمِينَ) **– və Hz. İbrahimin nəslindən neçə nəfəri də* - İsmayıl, Əlyəsa, Yunis və Lut peyğəmbəri də haqq tərəfinə hidayət edib hər birini öz aləmlərində olan məxluqata üstün etdik.**

وَمِنْ آبَائِهِمْ وَذُرِّيَّاتِهِمْ وَإِخْوَانِهِمْ وَاجْتَبَيْنَاهُمْ وَهَدَيْنَاهُمْ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٨٧﴾ ذَلِكَ هُدَى
اللَّهِ يَهْدِي بِهِ مَنْ يَشَاءُ مِنْ عِبَادِهِ وَلَوْ أَشْرَكُوا لَحَبِطَ عَنْهُمْ مَا كَانُوا يَعْمَلُونَ ﴿٨٨﴾ أُولَئِكَ الَّذِينَ
آتَيْنَاهُمُ الْكِتَابَ وَالْحُكْمَ وَالنُّبُوَّةَ فَإِنْ يَكْفُرْ بِهَا هَؤُلَاءِ فَقَدْ وَكَّلْنَا بِهَا قَوْمًا لَيْسُوا بِهَا بِكَافِرِينَ ﴿٨٩﴾
أُولَئِكَ الَّذِينَ هَدَى اللَّهُ فَبِهُدَاهُمُ اقْتَدِهِ

---

*(*****Qeyd:** Hərçənd Lut Hz. İbrahimin nəslindən deyil, ancaq Hz. İbrahimin qardaşı Harunun oğludur. Qardaşı oğlu olduğu üçün övlad sayıldı. Yəni qardaş oğlu insanın övladı kimidir. Hz. İsa da Hz. İbrahimin nəslindən olan qız övladıdır. Bu ayə buna dəlildir ki, şəxsin qız övladı oğul övladıyla eyni səviyyədədir).*

**87) (وَمِنْ آبَائِهِمْ وَذُرِّيَّاتِهِمْ وَإِخْوَانِهِمْ ) – bu qeyd olunan peyğəmbərlərin bəzisinin ata-babasına, övladlarına və qardaşlarına hidayət edib öz aləmlərində olan məxluqata üstün etdik.** (Peyğəmbərlərin bütün ata-babaları, övladları və qardaşları müvəhhid olmadığından Allah-Təala buyurur: "Onlardan bəzisinə hidayət edilib). **(وَاجْتَبَيْنَاهُمْ وَهَدَيْنَاهُمْ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ) – insanların arasından qeyd olunan şəxsləri seçib, düz yola hidayət etdik".**

**88) (ذَلِكَ هُدَى اللَّهِ يَهْدِي بِهِ مَنْ يَشَاءُ مِنْ عِبَادِهِ) – Allah-Təalanı şəriksiz bilib ona şərik qoşmamaq Allah-Təalanın hidayətidir. Allah-Təala öz bəndələrindən kimi istəsə, tövhidinə hidayət edər. (وَلَوْ أَشْرَكُوا) – əgər peyğəmbərlər və müvəhhid şəxslər hidayətdən sonra Allah-Təalaya şərik qoşsalar, (لَحَبِطَ عَنْهُمْ مَا كَانُوا يَعْمَلُونَ) – hər halda dünyada etdikləri yaxşı əməllər onlardan batil olub puç olar, şirk bütün əməlləri batil edər.** (Hərçənd peyğəmbərlər Allah-Təalaya şərik qoşmazlar, amma bu, ona işarədir ki, peyğəmbər də olsa, kim Allah-Təalaya şərik qoşsa, onun yaxşı əməlləri tamamən batil olar).

**89) (أُولَئِكَ الَّذِينَ آتَيْنَاهُمُ الْكِتَابَ وَالْحُكْمَ وَالنُّبُوَّةَ) – bu qeyd olunan peyğəmbərlərə halal və haram barəsində kitab, elm və peyğəmbərlik bəxş etdik. (فَإِنْ يَكْفُرْ بِهَا هَؤُلَاءِ) –** (ey Məhəmməd)**, əgər Məkkə əhli peyğəmbərliyi, Allah-Təala tərəfindən gələn kitabları inkar etsələr, (فَقَدْ وَكَّلْنَا بِهَا قَوْمًا لَيْسُوا بِهَا بِكَافِرِينَ) –** (ey Məhəmməd)**, həqiqətən, peyğəmbərliyə və kitablara iman gətirməyi sənin ümmətindən elə bir camaata həvalə edərik ki, onlara iman gətirib heç vaxt kafir olmazlar.** (Bu ayənin ehtivasına mühacir, ənsar və onlardan sonra gələn bütün müsəlmanlar daxildir, hansı ki Hz. Peyğəmbəri təsdiq edib, Qurana iman gətirib, Quranın fərmanıyla qeyd olunan peyğəmbərləri və onlara nazil olan kitabları təsdiq ediblər. Bəs bizim bu zəmanədə olan müsəlmanlar da bu ayənin ehtivasına daxildirlər, yoxsa yox? Allah-Təala bilir, amma onların əməlləri daxil olmadıqlarını göstərir).

**90) (أُولَئِكَ الَّذِينَ هَدَى اللَّهُ) –** (ey Məhəmməd)**, onlar bu qeyd olunan peyğəmbərlərdir ki, Allah-Təala onlara hidayət edib peyğəmbərlik bəxş edibdir. (فَبِهُدَاهُمُ اقْتَدِهِ) – sən də** (ey Məhəmməd)**, dində müvəhhid olmaqda bu qeyd**

قُلْ لَا أَسْأَلُكُمْ عَلَيْهِ أَجْرًا إِنْ هُوَ إِلَّا ذِكْرَى لِلْعَالَمِينَ ﴿٩٠﴾ وَمَا قَدَرُوا اللَّهَ حَقَّ قَدْرِهِ إِذْ قَالُوا مَا أَنْزَلَ اللَّهُ عَلَى بَشَرٍ مِنْ شَيْءٍ قُلْ مَنْ أَنْزَلَ الْكِتَابَ الَّذِي جَاءَ بِهِ مُوسَى نُورًا وَهُدًى لِلنَّاسِ تَجْعَلُونَهُ قَرَاطِيسَ تُبْدُونَهَا وَتُخْفُونَ كَثِيرًا وَعُلِّمْتُمْ مَا لَمْ تَعْلَمُوا أَنْتُمْ وَلَا آبَاؤُكُمْ قُلِ اللَّهُ ثُمَّ ذَرْهُمْ فِي خَوْضِهِمْ يَلْعَبُونَ ﴿٩١﴾ وَهَذَا كِتَابٌ أَنْزَلْنَاهُ مُبَارَكٌ

---

**olunan peyğəmbərlərin hidayətinə tabe olub onların yolunda ol ki, əsl iman və tövhid peyğəmbərlərin yoludur. (قُلْ لَا أَسْأَلُكُمْ عَلَيْهِ أَجْرًا)** – (ey Məhəmməd), **Məkkə əhlinə de ki, mən sizdən Allah-Təala ehkamını sizə yetirmək üçün bir əcr və muzd istəmirəm. Niyə məndən qaçırsınız?** (Hz. Peyğəmbər əvvəlcə onları xatircəm edir ki, sizdən dünya malı istəmirəm ki, güman etməsinlər ki, bəlkə dünyəvi səbəblərlə bu iddianı edirəm, çünki iki dost, iki qardaşın bir-birinə ehtiyacları olanda dünya malı onların arasına təfriqə salar, ehkamı təbliğ etmədə əcr və muzd istəməyin təfsilatı bu kitabın 2-ci cildi Yunis surəsinin 81-ci ayəsinin təfsirində bəyan olunacaqdır). **(إِنْ هُوَ إِلَّا ذِكْرَى لِلْعَالَمِينَ) – bu Quran bütün aləmlərdən ötrü ancaq bir öyüd-nəsihətdir).**

**91) (وَمَا قَدَرُوا اللَّهَ حَقَّ قَدْرِهِ) – Allah-Təalanı haqqı ilə tanımadılar, halbuki Allah-Təalanın lütf və rəhməti hər kəsə şamil olub özlərindən onlara peyğəmbər göndərib, bu böyük neməti inkar edib, (إِذْ قَالُوا مَا أَنْزَلَ اللَّهُ عَلَى بَشَرٍ مِنْ شَيْءٍ) – dedilər: “Allah-Təala insana heç bir şey nazil etməyib, insandan peyğəmbər göndərməyib”.** (Yəni bu Məhəmməd peyğəmbər deyil. Bu sözü yəhudilər də dedilər. Yəhudilərin bu sözü çox təəccüblüdür. Çünki Hz. Musaya və Tövrata iman gətiriblər). (qul mən ənzələl-kitabəlləzi caə bihi Musa nurən və hudən linnas) **(قُلْ مَنْ أَنْزَلَ الْكِتَابَ الَّذِي جَاءَ بِهِ مُوسَى نُورًا وَهُدًى لِلنَّاسِ)** – (ey Məhəmməd)**, de: “Deyirsiniz ki, Allah-Təala heç bir insana bir şey nazil etməyib, bəs o kitab** (Tövrat) **ki, Musa onu xalqdan ötrü nur və hidayət olduğu halda gətiribdir, bəs o kitabı Musaya kim nazil edibdir? (تَجْعَلُونَهُ قَرَاطِيسَ تُبْدُونَهَا) – ey yəhudi üləmaları, öz dininizə müvafiq Tövratı parça-parça kağızlara yazıb, bir qismini xalqa aşkar edib, deyirsiniz: Tövrat budur, xalqın arasına ixtilaf salırsınız.** (Hər bir millətin arasına ilk ixtilaf salan o millətin üləmasıdır). **(وَتُخْفُونَ كَثِيرًا) – Tövratın ehkamının çoxunu gizlədib haqq olan sözləri aşkar etmirsiniz, (وَعُلِّمْتُمْ مَا لَمْ تَعْلَمُوا أَنْتُمْ وَلَا آبَاؤُكُمْ)** – (ey yəhudi camaatı), (Hz. Məhəmmədə) **nazil olan elmlərdən o qədər öyrənibsiniz ki, nə siz bilirdiniz, nə də sizin ata-babalarınız, elmin qədrini bilməyib Hz. Məhəmmədə iman gətirmirsiniz. Quranın Allah-Təala tərəfindən nazil olduğunu inkar edirsiniz. (قُلِ اللَّهُ)** – (ey Məhəmməd)**, onlar Quranın sənə nazil olmasını inkar edirlər, sən de ki, Quranı Allah-Təala nazil edibdir. (ثُمَّ ذَرْهُمْ فِي خَوْضِهِمْ يَلْعَبُونَ) – ondan sonra onları tərk elə, qoy batil sözlərində qalıb istehza etsinlər. Allah-Təala onlardan intiqam alar.**

**92) (وَهَذَا كِتَابٌ أَنْزَلْنَاهُ مُبَارَكٌ)** – (ey Məhəmməd)**, bu Quran sənə nazil etdiyimiz çox mənfəətli və faydalı olan bir kitabdır. Faydası həmişə və**

مُصَدِّقُ الَّذِي بَيْنَ يَدَيْهِ وَلِتُنْذِرَ أُمَّ الْقُرَى وَمَنْ حَوْلَهَا وَالَّذِينَ يُؤْمِنُونَ بِالْآخِرَةِ يُؤْمِنُونَ بِهِ وَهُمْ عَلَى صَلَاتِهِمْ يُحَافِظُونَ ﴿٩٢﴾ وَمَنْ أَظْلَمُ مِمَّنِ افْتَرَى عَلَى اللهِ كَذِبًا أَوْ قَالَ أُوحِيَ إِلَيَّ وَلَمْ يُوحَ إِلَيْهِ شَيْءٌ وَمَنْ قَالَ سَأُنْزِلُ مِثْلَ مَا أَنْزَلَ اللهُ

---

**daimidir. Ağıl sahibləri hər bir zaman din və dünya işlərində Qurani-Şərifdən o zamanın şərtlərinə görə faydalana bilərlər. Və bu səbəbdən Qurani-Şərifdən sonra başqa bir kitab lazım deyildir. (مُصَدِّقُ الَّذِي بَيْنَ يَدَيْهِ) – bu Quran ondan əvvəl nazil olan kitabları təsdiq edəndir. (وَلِتُنْذِرَ أُمَّ الْقُرَى وَمَنْ حَوْلَهَا)** – (ey Məhəmməd)**, sənə bu Quranı nazil etdik ki, onunla Məkkə əhlini və Məkkənin ətrafında olan məxluqatı Allah-Təalanın əzabı ilə qorxudasan ki, islam dininə daxil olsunlar.** (Bu ayə buna dəlildir ki, Hz. Peyğəmbər bütün insanlığa göndərilibdir, çünki Məkkənin ətrafı şərqdən qərbə, cənubdan şimala bütün dünyadır. Hz. Peyğəmbər də Məkkə və ətrafına ehkamı təbliğ etməklə məsuldur. Necə ki ayədə qeyd olundu, təfsirçilər də belə deyiblər. Amma ayənin bu mətləbə işarəsində təfəkkür etmək lazımdır. Hz. Peyğəmbərin bütün bəşəriyyətə göndərilməsinə işarə olaraq Qurani-Şərifdə başqa ayələr, dəlillər də vardır. Bəzisi əvvəldə, bəzisi bundan sonra qeyd olunacaq. Amma bu ayənin işarəsi aydın deyildir). **(وَالَّذِينَ يُؤْمِنُونَ بِالْآخِرَةِ يُؤْمِنُونَ بِهِ) – o şəxslər ki axirətə iman gətirirlər, belə şəxslər Qurana da iman gətirirlər. (وَهُمْ عَلَى صَلَاتِهِمْ) يُحَافِظُونَ - axirətə və Qurana iman gətirən şəxslər namazlarına möhkəm yapışıb hər bir vaxt namazlarını qılarlar.** (Ey Peyğəmbər, indi Mədinə torpağından baş qaldırıb bu ümmətinə tamaşa et. Allah-Təalanın sənə əmr etdiyi ibadət müsəlmanlar tərəfindən gör necə tərk edilibdir. Hətta namaz qılana bəzən məsxərə və istehza da edirlər? Ey Peyğəmbər, bu namaz həmin ibadətdir ki, onu qılmaqdan sənin mübarək ayaqların şişmişdi, əfsus, ümmət belə ibadəti tərk edib, ondan ötrü cürbəcür yozumlar edirlər ki, heç sənin xəyalına gəlməzdi).

**93) (وَمَنْ أَظْلَمُ مِمَّنِ افْتَرَى عَلَى اللهِ كَذِبًا) – bu şəxsdən daha zalım olan kimdir, hansı ki Allah-Təalaya yalandan iftira edib, - məni Allah-Təala peyğəmbər göndəribdir, deyir? (أَوْ قَالَ أُوحِيَ إِلَيَّ وَلَمْ يُوحَ إِلَيْهِ شَيْءٌ) – ya da Allah-Təala mənə vəhy edibdir desin? Halbuki Allah-Təala ona heç bir şey vəhy göndərməyibdir.** (Belə* olan halda bu Məhəmməd necə özünü zalımlar cərgəsinə daxil edib Allah-Təalaya yalan, iftira atar, halbuki sizin aranızda əmin və sadiq şəxsdir. Belə şəxs Allah-Təalaya iftira etməz. Hz. Məhəmmədin dediyi hər bir söz Allah-Təaladandır). **(وَمَنْ قَالَ سَأُنْزِلُ مِثْلَ مَا أَنْزَلَ اللهُ) – və yenə - mən də Allah-Təalanın göndərdiyi Quranın bənzərini gətirərəm deyən şəxsdən daha zalım olan kimdir?*** (Bu şəxs Nəzr ibn Haris idi)**.**

*(*Qeyd: Bu sözü deyən Yəmamə əhlindən Müseyləmə, Səna əhlindən Əsvəd Ansi idi. Hər ikisi peyğəmbərlik iddiası etdilər. Əsvədi Hz. Peyğəmbərin zamanında vəfa-*

وَلَوْ تَرَى إِذِ الظَّالِمُونَ فِي غَمَرَاتِ الْمَوْتِ وَالْمَلَائِكَةُ بَاسِطُو أَيْدِيهِمْ أَخْرِجُوا أَنْفُسَكُمُ الْيَوْمَ تُجْزَوْنَ عَذَابَ الْهُونِ بِمَا كُنْتُمْ تَقُولُونَ عَلَى اللّٰهِ غَيْرَ الْحَقِّ وَكُنْتُمْ عَنْ آيَاتِهِ تَسْتَكْبِرُونَ ﴿٩٣﴾ وَلَقَدْ جِئْتُمُونَا فُرَادَى كَمَا خَلَقْنَاكُمْ أَوَّلَ مَرَّةٍ وَتَرَكْتُمْ مَا خَوَّلْنَاكُمْ وَرَاءَ ظُهُورِكُمْ وَمَا نَرَى مَعَكُمْ شُفَعَاءَكُمُ الَّذِينَ زَعَمْتُمْ أَنَّهُمْ فِيكُمْ شُرَكَاءُ

---

*tından əvvəl Feyruz Deyləmi qətlə yetirdi. Hz. Peyğəmbərdən sonra Əbu Bəkir Müseylimənin üstünə qoşun göndərib, Vəhşi (Həmzənin qatili) onu qətlə yetirdi. Və hətta o, belə demişdir: "Mən kafir olarkən insanların ən yaxşısını (yəni Həmzəni), mömin olarkən isə insanların ən pisini (yəni Müseyliməni) öldürdüm).*

**Lakin Məkkə əhlindən və başqa istehza edənlərdən heç kim Quranın bənzərini gətirmədi və gətirə də bilməzdi. (وَلَوْ تَرَى إِذِ الظَّالِمُونَ فِي غَمَرَاتِ الْمَوْتِ) -** (ey Məhəmməd), **əgər bu qeyd olunan zalımları ölüm anında şiddətlə can verərkən bir görsən, (وَالْمَلَائِكَةُ بَاسِطُو أَيْدِيهِمْ أَخْرِجُوا أَنْفُسَكُمُ) - mələklər əllərini onlara tərəf açıb deyərlər: "Gətirin ruhlarınızı bədənlərinizdən çıxarın. İndi sizə bir dəqiqə də möhlət yoxdur". (Necə ki borclu şəxsə deyərlər: gətir bu saat mənim malımı ver, malımı almayınca buradan gedən deyiləm. Zalımların canını almaq da buna oxşadılır, borc sahibi malını zorla alan kimi mələklər də onun canını zorla alarlar, almadıqca oradan getməzlər). (الْيَوْمَ تُجْزَوْنَ عَذَابَ) الْهُونِ بِمَا كُنْتُمْ تَقُولُونَ عَلَى اللّٰهِ غَيْرَ الْحَقِّ - can verərkən o zalımlara deyilər: "Dünyada haqq olmayan sözləri Allah-Təalaya isnad etdiyiniz üçün bu gün sizə son dərəcə zəlil və həqir edən əzab cəzası verilir. - (وَكُنْتُمْ عَنْ آيَاتِهِ تَسْتَكْبِرُونَ) və bir də o səbəbə görə ki, təkəbbürlənib, Allah-Təalanın möcüzələrinə iman gətirmədiniz".**

**94 (وَلَقَدْ جِئْتُمُونَا فُرَادَى كَمَا خَلَقْنَاكُمْ أَوَّلَ مَرَّةٍ)** - (qiyamət günündə Allah-Təala asilərə və müşriklərə buyurar:) **dünyada ömürlərinizi cah-cəlal və dünya malı qazanmaqla fani etdiniz. Allah-Təaladan başqa özünüz kimi məxluqlardan, hətta cansızlardan kömək istəyib onlara etimad etdiniz. Bugünkü gündə sizə heç bir fayda verməyib, bizim tərəfə yalqız, mal, övlad, cah-cəlaldan ayrılmış halda gəldiniz, necə ki sizi ilk dəfə dünyaya təkbaşına gətirmişdik. Həmin halətdə bizim tərəfimizə gəldiniz. Hanı o şeylər ki, dünyada onlara etimad edirdiniz? (وَتَرَكْتُمْ مَا خَوَّلْنَاكُمْ وَرَاءَ ظُهُورِكُمْ) - o şeyləri ki, dünyada lütf edib sizə nemət vermişdik, onlardan heç bir fayda əldə etmədiniz.** (Dünya malı dünyada xərclənən şeydir, din və məzhəbin, ümmətin övladlarının tərəqqisi yolunda bir dinar da sərf etmədiniz). **Hamısını yığıb, dünyada varislərdən ötrü qoydunuz, əliboş halda bizim tərəfimizə gəldiniz.** (Bəs dünya malından nə əldə etdiniz? Ondan bir fayda əldə etmədiniz, qaldı sadəcə Allah-Təalaya itaət etmək, ona da əməl etməyib özünüzdən ötrü şəfaətçilər xəyal etdiniz. İndi hanı sizin o şəfaətçiləriniz ki, bugünkü gündə sizə fayda versinlər?) **(وَمَا نَرَى مَعَكُمْ شُفَعَاءَكُمُ الَّذِينَ زَعَمْتُمْ أَنَّهُمْ فِيكُمْ شُرَكَاءُ) - hanı?**

لَقَدْ تَقَطَّعَ بَيْنَكُمْ وَضَلَّ عَنْكُم مَا كُنْتُمْ تَزْعُمُونَ ﴿٩٤﴾ إِنَّ اللَّهَ فَالِقُ الْحَبِّ وَالنَّوَى يُخْرِجُ الْحَيَّ
مِنَ الْمَيِّتِ وَمُخْرِجُ الْمَيِّتِ مِنَ الْحَيِّ ذَلِكُمُ اللَّهُ فَأَنَّى تُؤْفَكُونَ ﴿٩٥﴾ فَالِقُ الْإِصْبَاحِ وَجَعَلَ اللَّيْلَ
سَكَنًا وَالشَّمْسَ وَالْقَمَرَ حُسْبَانًا ذَلِكَ تَقْدِيرُ الْعَزِيزِ الْعَلِيمِ ﴿٩٦﴾ وَهُوَ الَّذِي جَعَلَ لَكُمُ النُّجُومَ

---

**Bugünkü gündə sizinlə birlikdə o şəfaətçi saydığınız şeyləri görmürük, onların barəsində etiqadınız bu idi ki, onlar Allah-Təalaya şərikdirlər. Necə oldu onlar, bugünkü gündə harada qalıblar? Gəlib sizə kömək olsunlar. (لَقَدْ تَقَطَّعَ بَيْنَكُمْ) – yox, heç kəsə kömək ola bilməzlər, həqiqətən, o şəriklərlə sizin aranızdakı əlaqə kəsildi. Heç vaxt onlar sizə kömək ola bilməz. (وَضَلَّ عَنْكُم مَا كُنْتُمْ تَزْعُمُونَ) – özünüzə şəfaətçi və Allah-Təalaya şərik saydığınız şeylər sizdən qeyb olub getdilər və onlardan sizə heç bir kömək olmaz.**

**95) (إِنَّ اللَّهَ فَالِقُ الْحَبِّ وَالنَّوَى) –** (ey Məhəmməd), **xalqa de ki, həqiqətən, çəyirdəyi də, toxumu da yarıb onlardan bitki və ağac göyərdən Allah-Təaladır, yoxsa Allah-Təalaya şərik qoşduğunuz bütlər deyil. (يُخْرِجُ الْحَيَّ مِنَ الْمَيِّتِ) – çəyirdəyi yarıb göyərdən Allah-Təala dirini ölüdən** (insanı və heyvanı spermadan, bitki və ağacları çəyirdək və toxumdan) **çıxarar. (وَمُخْرِجُ الْمَيِّتِ مِنَ الْحَيِّ) – ölünü də diridən** (spermanı heyvandan, çəyirdək və toxumu bitki və ağacdan) **çıxarar. (ذَلِكُمُ اللَّهُ فَأَنَّى تُؤْفَكُونَ) – dirini ölüdən və ölünü diridən çıxaran sizin Allah-Təalanızdır. Belə Allah-Təaladan necə üz döndərib, ondan başqasını özünüzə məbud edərsiniz?**

**96) (فَالِقُ الْإِصْبَاحِ) – gecənin zülmətini yarıb sübhü ondan ayıran Allah-Təaladır. (وَجَعَلَ اللَّيْلَ سَكَنًا) – Allah-Təala sizdən ötrü gecəni istirahət zamanı etdi. (وَالشَّمْسَ وَالْقَمَرَ حُسْبَانًا) – günəşə isnad edilən hərəkəti və ayın hərəkətini Allah-Təala sizdən ötrü hesab ölçüsü etdi ki, onlarla hesab* tutasınız.** (Bir şəmsi il bərabərdir bir qəməri il + bir ay). **(ذَلِكَ تَقْدِيرُ الْعَزِيزِ الْعَلِيمِ) – günəşin və ayın hesabı, məlum olan hərəkətləri bir Allah-Təalanın təyini və hökmüdür, onlar onun qüdrətinə tabedir, Allah onları idarə etməyə və onları necə hərəkət etdirməyə agahdır** (sübhanəhu ma azəmə şanuhu)

*(*Qeyd:* **Qeyd:** *Belə xəyal edilməsin ki, göyün və ayın faydası ancaq hesab tutmaqdan ibarətdir. Ayənin mənası bu deyil, bəlkə ayənin mənası odur ki, ayın, günəşin hesab tutmaqda da faydası var. Amma əsl faydaları çox olub, insanın idrak gücünün üstündədir, burada məqsəd onların əsl faydasını tamamilə bəyan etmək olmayıb, sadəcə onların hərəkət etməsindəki faydanın bir qismini bəyan etməkdir).*

**97) (وَهُوَ الَّذِي جَعَلَ لَكُمُ النُّجُومَ) – sizə lütf edib sizdən ötrü nurani* ulduzlar yaradan da Allah-Təaladır.**

*(****Qeyd:** *Ulduzların səhrada və dənizdə yol göstərdiyi hər bir şəxsə məlumdur. İnsanın əgər astronomiya elmindən bir qədər məlumatı olsa və ulduzların bəzilərini*

لِتَهْتَدُوا بِهَا فِي ظُلُمَاتِ الْبَرِّ وَالْبَحْرِ قَدْ فَصَّلْنَا الْآيَاتِ لِقَوْمٍ يَعْلَمُونَ ﴿٩٧﴾ وَهُوَ الَّذِي أَنْشَأَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ فَمُسْتَقَرٌّ وَمُسْتَوْدَعٌ قَدْ فَصَّلْنَا الْآيَاتِ لِقَوْمٍ يَفْقَهُونَ ﴿٩٨﴾ وَهُوَ الَّذِي أَنْزَلَ مِنَ السَّمَاءِ مَاءً فَأَخْرَجْنَا بِهِ نَبَاتَ كُلِّ شَيْءٍ فَأَخْرَجْنَا مِنْهُ خَضِرًا نُخْرِجُ مِنْهُ حَبًّا مُتَرَاكِبًا وَمِنَ النَّخْلِ مِنْ طَلْعِهَا قِنْوَانٌ دَانِيَةٌ وَجَنَّاتٍ مِنْ أَعْنَابٍ وَالزَّيْتُونَ وَالرُّمَّانَ مُشْتَبِهًا وَغَيْرَ مُتَشَابِهٍ انْظُرُوا إِلَى ثَمَرِهِ إِذَا أَثْمَرَ وَيَنْعِهِ

---

*adlarıyla tanısa, gecə vaxtı hava saf və sakit olanda səmaya baxanda onların bir-birindən uzaqlığını və yaxınlığını və xüsusiyyətlərini, vəziyyətlərini, dəyişib müxtəlif surətlərə girdiyini dərk etsə, sanki, o vaxt ondan ötrü yeni bir alim peyda olub Allahın vəhdaniyyətini aydın bir şəkildə ona aydın edər).*

(لِتَهْتَدُوا بِهَا فِي ظُلُمَاتِ الْبَرِّ وَالْبَحْرِ) – **Belə ki, o ulduzların səbəbinə səhrada və dənizdə gecənin qaranlığında hidayət tapıb yolunuzdan azmayasınız.** (قَدْ فَصَّلْنَا الْآيَاتِ لِقَوْمٍ يَعْلَمُونَ) – (ey Məhəmməd)**, həqiqətən, bizim vəhdaniyyət və qüdrətimizə işarə edən əlamətləri elm sahibi olan camaatdan ötrü təfərrüatı ilə bəyan etdik. Ta ki elm sahibi olan şəxslər bu qeyd olunan məxluqlarla Allah-Təalanın qüdrətindən agah olsunlar.**

**98)** (وَهُوَ الَّذِي أَنْشَأَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ) – **bütün insanlığı tək bir nəfər adamdan yaradan Allah-Təaladır.** (Hərçənd bütün insanlıq Adəm və xanımı Həvvadan törəyibdir. Amma Allah-Təalanın soyu təkcə Adəmə isnad etməsi soyda atanın mötəbər olmasına işarədir). (فَمُسْتَقَرٌّ وَمُسْتَوْدَعٌ) – **Allah-Təala sizdən ötrü anaların rəhmini, ataların onurğa sümüyünü** (belini) **əmanət yeri etdi. İlk olaraq atanın onurğa sümüyünü** (belini)**, ondan sonra ananın rəhmini əmanət yeri etdi.** (قَدْ فَصَّلْنَا الْآيَاتِ لِقَوْمٍ يَفْقَهُونَ) – **həqiqətən, bizim kamil qüdrətimizə işarə edən əlamətləri diqqətlə baxıb həqiqi mətləbi dərk edən bir camaatdan ötrü təfsilatı ilə bəyan etdik.**

**99)** (وَهُوَ الَّذِي أَنْزَلَ مِنَ السَّمَاءِ مَاءً) – (ey Məhəmməd)**, sənin Allahın elə bir Allahdır ki, səmadan su göndərdi.** (فَأَخْرَجْنَا بِهِ نَبَاتَ كُلِّ شَيْءٍ) – **o suyun səbəbinə yerdən hər bir bitkini göyərdib çıxartdıq.** (فَأَخْرَجْنَا مِنْهُ خَضِرًا) – **o göyərən şeylərdən təzə tərəvəzlər, bir kökdən neçə budaqlar çıxartdıq.** (نُخْرِجُ مِنْهُ حَبًّا مُتَرَاكِبًا) – **o bir kökdən ayrılan budaqlardan bir-birinin üstünə cəm olub sünbül içində olan dənələr** (buğda, arpa, düyü, darı və s.) **çıxardarıq,** (وَمِنَ النَّخْلِ مِنْ طَلْعِهَا قِنْوَانٌ دَانِيَةٌ) – **sizdən ötrü yetişən xurma ağacından çıxan tumurcuğun içindən asanlıqla salxımlar çıxardarıq,** (وَجَنَّاتٍ مِنْ أَعْنَابٍ وَالزَّيْتُونَ وَالرُّمَّانَ) – **və sizdən ötrü üzüm, zeytun və nardan bağlar yaratdıq.** (مُشْتَبِهًا وَغَيْرَ مُتَشَابِهٍ) – **bu meyvələrdən bəzisi rəngdə və dadda bir-birinə oxşayar, bəzisi də oxşamaz.** (Məsələn, üzümün, narın bəzisinin rəngi və dadı eyni olar, bəzisinin rəngi, dadı başqa olar). (انْظُرُوا إِلَى ثَمَرِهِ إِذَا أَثْمَرَ) – **ilk çıxanda bunların meyvələrinə baxın ki, necə zahir olurlar?** (وَيَنْعِهِ) – **ondan sonra fikir verib onların yetişməsinə baxın ki, necə tədricən böyüyüb, günəşin hərarəti on-**

إِنَّ فِي ذَٰلِكُمْ لَآيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٩٩﴾ وَجَعَلُوا لِلَّهِ شُرَكَاءَ الْجِنَّ وَخَلَقَهُمْ وَخَرَقُوا لَهُ بَنِينَ وَبَنَاتٍ
بِغَيْرِ عِلْمٍ سُبْحَانَهُ وَتَعَالَىٰ عَمَّا يَصِفُونَ ﴿١٠٠﴾ بَدِيعُ السَّمَاوَاتِ وَالْأَرْضِ أَنَّىٰ يَكُونُ لَهُ وَلَدٌ وَلَمْ
تَكُنْ لَهُ صَاحِبَةٌ وَخَلَقَ كُلَّ شَيْءٍ وَهُوَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿١٠١﴾ ذَٰلِكُمُ اللَّهُ رَبُّكُمْ لَا إِلَٰهَ إِلَّا هُوَ
خَالِقُ كُلِّ شَيْءٍ فَاعْبُدُوهُ وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ وَكِيلٌ ﴿١٠٢﴾ لَا تُدْرِكُهُ الْأَبْصَارُ وَهُوَ يُدْرِكُ الْأَبْصَارَ

---

**ları bişirib yeyiləcək hala gələrlər.** (Bəs bunlarda sizdən ötrü Allah-Təalanın qüdrətli varlığına bir dəlil yoxdurmu? Bəs xəyal edirsiniz ki, materialistlərin dediyi kimi bunlar qüdrətli bir yaradıcıları olmadan əmələ gəliblər? Hey-hat, necə də ağlın yolundan kənar olubsunuz). **(إِنَّ فِي ذَٰلِكُمْ لَآيَاتٍ لِقَوْمٍ يُؤْمِنُونَ) – həqiqətən, sizə zikr olunan bu şeylərdə iman gətirənlərdən ötrü Allah-Təalanın kamil qüdrətinə dəlil və sübutlar vardır.**

**100) (وَجَعَلُوا لِلَّهِ شُرَكَاءَ الْجِنَّ وَخَلَقَهُمْ) – müşriklər cinləri Allah-Təalaya şərik saydılar, halbuki cinləri də Allah-Təala yaradıbdır. Necə ola bilər ki, onlar Allah-Təalaya şərik olsunlar? (وَخَرَقُوا لَهُ بَنِينَ وَبَنَاتٍ بِغَيْرِ عِلْمٍ) – insanlar elmsiz, cahilcəsinə Allah-Təalaya oğlanlar və qızlar isnad etdilər. (Xristianlar dedilər: "Məsih Allah-Təalanın oğludur," yəhudilər dedilər: "Üzeyir Allah-Təalanın oğludur," Qüreyş dedi: "Mələklər Allah-Təalanın qızlarıdır"). (سُبْحَانَهُ وَتَعَالَىٰ عَمَّا يَصِفُونَ) – Allah-Təala ona isnad edilən xüsusiyyətlərdən – şərik və övlad sahibi olmaqdan pak, müqəddəs və ucadır.**

**101) (بَدِيعُ السَّمَاوَاتِ وَالْأَرْضِ) – səmalarda və yerdə Allah-Təalanın bənzəri və oxşarı yoxdur. (أَنَّىٰ يَكُونُ لَهُ وَلَدٌ وَلَمْ تَكُنْ لَهُ صَاحِبَةٌ) – Allah-Təalanın necə övladı olar? Övlad cütlükdən meydana gələr, halbuki Allah-Təalanın yoldaşı** (zövcəsi) **yoxdur. Bənzəri, oxşarı olmayan Allah-Təalanın yoldaşı** (zövcəsi) **ola bilməz. (وَخَلَقَ كُلَّ شَيْءٍ وَهُوَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) – Allah-Təalanın necə yoldaşı ola bilər? Halbuki bütün şeyləri Allah-Təala yaradıbdır. Məxluq Xaliqə oxşar ola bilməz. Oxşarı yoxdursa, yoldaşı da olmaz. Yoldaş olmayanda övlad da olmaz. Bəs siz necə deyirsiniz ki, Allah-Təalanın övladı vardır? Halbuki Allah-Təala bütün şeylərdən agahdır. Buna da agahdır ki, yoldaşı və övladı yoxdur. Lakin siz ona iftira edirsiniz.**

**102) (ذَٰلِكُمُ اللَّهُ رَبُّكُمْ لَا إِلَٰهَ إِلَّا هُوَ) – bu qeyd olunan xüsusiyyətlərin sahibi Allah-Təaladır, sizin rəbbiniz və ibadətə layiq olan ancaq yeganə olan Allah-Təaladır, ondan başqa məbudlar, bütlər batildir. (خَالِقُ كُلِّ شَيْءٍ فَاعْبُدُوهُ) – hər bir şeyin xaliqi Allah-Təaladır, ona ibadət edin, (وَهُوَ عَلَىٰ كُلِّ شَيْءٍ وَكِيلٌ) – hər bir şeyin vəkili və onları idarə edən Allah-Təaladır.**

**103) (لَا تُدْرِكُهُ الْأَبْصَارُ) – gözlərdə olan qüvvələr Allah-Təalanı dərk edib görə bilməzlər. (Göz ancaq cismi dərk edə bilər, Allah-Təala cisim olmaqdan pak və müqəddəs olduğu üçün dərk edilə bilməz). (وَهُوَ يُدْرِكُ الْأَبْصَارَ)**

**وَهُوَ اللَّطِيفُ الْخَبِيرُ ﴿١٠٣﴾ قَدْ جَاءَكُمْ بَصَائِرُ مِنْ رَبِّكُمْ فَمَنْ أَبْصَرَ فَلِنَفْسِهِ وَمَنْ عَمِيَ فَعَلَيْهَا وَمَا أَنَا عَلَيْكُمْ بِحَفِيظٍ ﴿١٠٤﴾ وَكَذَلِكَ نُصَرِّفُ الْآيَاتِ وَلِيَقُولُوا دَرَسْتَ وَلِنُبَيِّنَهُ لِقَوْمٍ يَعْلَمُونَ ﴿١٠٥﴾ اتَّبِعْ مَا أُوحِيَ إِلَيْكَ مِنْ رَبِّكَ لَا إِلَهَ إِلَّا هُوَ وَأَعْرِضْ عَنِ الْمُشْرِكِينَ ﴿١٠٦﴾ وَلَوْ شَاءَ اللَّهُ مَا أَشْرَكُوا وَمَا جَعَلْنَاكَ عَلَيْهِمْ حَفِيظًا**

---

– **Allah-Təala gözlərin həqiqətini dərk edər.** (Gözün batinində olan damarlarda əmanət qoyulan qüvvənin həqiqətini Allah-Təala dərk edər, heç vaxt o qüvvə Allah-Təalanı dərk edə bilməz). **(وَهُوَ اللَّطِيفُ الْخَبِيرُ) – Allah-Təala elə lətifdir ki, gözlər onu dərk edə bilməz. Amma özü hər bir lətif və incə olan şeylərdən agahdır, onları dərk edər və heç bir şey onun elmindən qeyb olmaz.**

**104) (قَدْ جَاءَكُمْ بَصَائِرُ مِنْ رَبِّكُمْ)** – (ey Məhəmməd), **xalqa de: sizə rəbbiniz Allah-Təaladan elə dəlillər** (Qurani-Şərifin surələri və ayələri) **gəldi ki, onlarla qəlbiniz nurani olub haqqa qovuşarsınız. (فَمَنْ أَبْصَرَ فَلِنَفْسِهِ) – kim o dəlillərin səbəbinə bəsirət sahibi və qəlbi nurani olub haqqa qovuşsa, onun mənfəəti özünə aid olar. (وَمَنْ عَمِيَ فَعَلَيْهَا) – və kim ki kor olub, haqqa qovuşmasa, onun zərəri özünə aid olar. (وَمَا أَنَا عَلَيْكُمْ بِحَفِيظٍ) – mən sizin əməllərinizi mühafizə edib saxlayan deyiləm ki, onlara cəza verəm. Sizin əməllərinizi mühafizə edib cəza verən Allah-Təaladır.**

**105) (وَكَذَلِكَ نُصَرِّفُ الْآيَاتِ وَلِيَقُولُوا دَرَسْتَ)** – (ey Məhəmməd), **biz Qurani-Şərifdə səndən ötrü hər bir hökmdə ayələr nazil etdik, o səbəbə görə müşriklər sənə deyirlər ki, bu Quranı özgədən öyrənibsən, qoy o ayələrə fikir verib özgədən öyrənmədiyini anlasınlar, əgər özgədən öyrənmiş olsaydın, belə bir kəlam onların özlərindən də meydana gələrdi. (وَلِنُبَيِّنَهُ لِقَوْمٍ يَعْلَمُونَ) – Qurani-Şərifin ayələrini elm sahiblərindən ötrü bəyan edirik ki, onun haqq olmasını dərk etsinlər.** (Yəni əql və kamal sahibləri Quranın həqiqətini bilib ona tabe olarlar).

**106) (اتَّبِعْ مَا أُوحِيَ إِلَيْكَ مِنْ رَبِّكَ)** – (ey Məhəmməd), **Allah-Təaladan vəhy olunan hökmlərə tabe olub sənə tabe olan şəxslərə də o hökmləri yetir. (لَا إِلَهَ إِلَّا هُوَ) – Allahdan başqa haqq olan məbud yoxdur, hansı ki sənə kitab göndəribdir. (وَأَعْرِضْ عَنِ الْمُشْرِكِينَ) – müşriklərdən üz döndərib onların sözlərinə cavab vermə, çünki onlar ağla uyğun hərəkət etmirlər.**

**107) (وَلَوْ شَاءَ اللَّهُ مَا أَشْرَكُوا) – əgər Allah-Təala istəsə, ona şərik qoşa bilməzlər, zorla insanların hamısını müvəhhid edər.** (Amma bu aləm seçim, ixtiyar aləmidir, kim özündən ötrü nə seçsə, Allah-Təala da onun qarşılığını* o şəxsə yetirəcəkdir). **(وَمَا جَعَلْنَاكَ عَلَيْهِمْ حَفِيظًا)** – (ey Məhəmməd), **səni müşriklərin əməllərinə nəzarət edib onlara cəza verən təyin etməmişik.**

وَمَا أَنْتَ عَلَيْهِمْ بِوَكِيلٍ ﴿١٠٧﴾ وَلَا تَسُبُّوا الَّذِينَ يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ فَيَسُبُّوا اللّٰهَ عَدْوًا بِغَيْرِ عِلْمٍ
كَذٰلِكَ زَيَّنَّا لِكُلِّ أُمَّةٍ عَمَلَهُمْ ثُمَّ إِلَى رَبِّهِمْ مَرْجِعُهُمْ فَيُنَبِّئُهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ ﴿١٠٨﴾

---

**(وَمَا أَنْتَ عَلَيْهِمْ بِوَكِيلٍ) – və onların da vəkili deyilsən ki, işlərinin ixtiyarı səndə olsun və onlara ruzi qismət edəsən,** (bunların hamısı Allah-Təalanın qüdrətindədir. Heç bir məxluq bu işləri idarə edə bilməz).

*(*Qeyd:* **Qeyd:** *Əbu Talib (Hz. Peyğəmbərin əmisi və yardımçısı) Məkkədə naxoş oldu. Qüreyş camaatı yığılıb dedi: "Gəlin gedək Əbu Talibin yanına, qoy qardaşı oğlu Məhəmmədə nəsihət etsin ki, bizdən əl çəksin. Həya edirik ki, Əbu Talib öləndən sonra onu öldürək. Onda ərəblər də deyər ki, nə qədər ki əmisi Əbu Talib var idi, ona yardımçı idi, elə ki Əbu Talib öldü, onu qətlə yetirdilər". Qüreyşin rəislərindən Əbu Süfyan, Əbu Cəhl, Nəzr ibnül-Haris, Ümeyyə ibn Xələf, oğulları Uqbə və Əmr ibnül-As, Əsvəd ibn Əbül-Büxtəri Əbu Talibin yanına gəlib dedilər: "Ey Əbu Talib, sən bizim böyüyümüz və ağamızsan. Məhəmməd bizə əziyyət verib məbudlarımızı batil edir, səndən xahiş edirik, ona deyəsən ki, bizim məbudlarımızdan əl çəksin, biz də onun məbudundan əl çəkək, öz məbuduyla qalsın". Əbu Talib Hz. Peyğəmbəri dəvət edib dedi: "Bunlar sənin əmin oğlanlarıdır. Gör nə deyirlər?" Hz. Peyğəmbər buyurdu: "Nə deyirsiniz?" Dedilər: "Səndən istəyirik ki, biz öz məbudlarımızla olaq, sən də öz məbudunla. Bizim məbudlarımızdan əl çək". Əbu Talib dedi: "Qardaş oğlu, insaf üzrə danışdılar, ey Məhəmməd, onların sözünü qəbul elə". Hz. Peyğəmbər buyurdu: "Əgər məndən bircə söz qəbul edib, o kəlməni desəniz, bütün ərəb və əcəmə malik olub sizə xərac verərlər". Əbu Cəhl dedi: "Onun kimi on kəlmə də qəbul edərik". Hz. Peyğəmbər buyurdu: "Bir dəfə deyin ki, la ilahə illallah". Bu sözü eşidən kimi hamısı nifrətlə ondan üz döndərdi. Əbu Talib dedi: "Qardaş oğlu, bundan başqa söz de". Hz. Peyğəmbər buyurdu: "Əmi, bundan başqa sözüm yoxdur. Əgər bu Qüreyş o böyüklükdəki günəşi götürməyə qadir olub, mənim əlimə qoysalar da, mənim bundan başqa deyəcək sözüm yoxdur").*

**108) (وَلَا تَسُبُّوا الَّذِينَ يَدْعُونَ مِنْ دُونِ اللّٰهِ فَيَسُبُّوا اللّٰهَ عَدْوًا بِغَيْرِ عِلْمٍ) – (müsəlmanlar Məkkədə müşriklərin bütlərini söyürdülər. Allah-Təala bu ayədə onlara söyüş söyməyi qadağan edir, buyurur:) ey müsəlmanlar, müşriklərin Allah-Təaladan başqa ibadət etdiyi bütlərə söyməyin. Yoxsa buna səbəb olarsınız ki, onlar da elmsizliklə, cəhalət üzrə Allah-Təalaya nalayiq sözlər deyərlər. (كَذٰلِكَ زَيَّنَّا لِكُلِّ أُمَّةٍ عَمَلَهُمْ) – bu müşriklərin əməlləri öz nəzərlərində gözəl olduğu kimi kafirlərin nəzərində də** (Allah-Təalaya şərik qoşma) **əməllərini gözəl göstərib, yardımımızı onlardan kəsdik ki, imandan bir dəfəlik kənar olub, iman gətirməzlər. (ثُمَّ إِلَى رَبِّهِمْ مَرْجِعُهُمْ) – ondan sonra hamısının qayıdacağı yer öz rəbləri Allah-Təalanın tərəfinə olub, (فَيُنَبِّئُهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ) – O da dünyada etdikləri əməllərini onlara xəbər verib o əməllərin cəzasını onlara yetirəcəkdir.**

وَأَقْسَمُوا بِاللَّهِ جَهْدَ أَيْمَانِهِمْ لَئِنْ جَاءَتْهُمْ آيَةٌ لَيُؤْمِنُنَّ بِهَا قُلْ إِنَّمَا الْآيَاتُ عِنْدَ اللَّهِ وَمَا يُشْعِرُكُمْ أَنَّهَا
إِذَا جَاءَتْ لَا يُؤْمِنُونَ ﴿١٠٩﴾ وَنُقَلِّبُ أَفْئِدَتَهُمْ وَأَبْصَارَهُمْ كَمَا لَمْ يُؤْمِنُوا بِهِ أَوَّلَ مَرَّةٍ وَنَذَرُهُمْ
فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ ﴿١١٠﴾ وَلَوْ أَنَّنَا نَزَّلْنَا إِلَيْهِمُ الْمَلَائِكَةَ وَكَلَّمَهُمُ الْمَوْتَى وَحَشَرْنَا عَلَيْهِمْ كُلَّ
شَيْءٍ قُبُلًا مَا كَانُوا لِيُؤْمِنُوا إِلَّا أَنْ يَشَاءَ اللَّهُ وَلَكِنَّ أَكْثَرَهُمْ يَجْهَلُونَ ﴿١١١﴾ وَكَذَلِكَ جَعَلْنَا لِكُلِّ
نَبِيٍّ عَدُوًّا شَيَاطِينَ الْإِنْسِ وَالْجِنِّ

---

**109) (وَأَقْسَمُوا بِاللَّهِ جَهْدَ أَيْمَانِهِمْ)** – (ey Məhəmməd)**, bu müşriklər Allah-Təalaya möhkəm and içdilər. (لَئِنْ جَاءَتْهُمْ آيَةٌ لَيُؤْمِنُنَّ بِهَا) – əgər onlara Allah-Təala tərəfindən özləri istəyən möcüzələrdən bir möcüzə gəlsə, əlbəttə, iman gətirib islama daxil olarlar. (قُلْ إِنَّمَا الْآيَاتُ عِنْدَ اللَّهِ) – müşriklərə de ki, möcüzə Allah-Təalanın yanındadır, əgər məsləhət görsə, möcüzə göndərər. (وَمَا يُشْعِرُكُمْ أَنَّهَا إِذَا جَاءَتْ لَا يُؤْمِنُونَ)** – (ey Məhəmməd)**, siz istəyirsiniz ki, onların istədiyi möcüzə gəlsin ki, iman gətirsinlər, amma bunu bilmirsiniz ki, o möcüzə onlara gəlsə də, onlar iman gətirməzlər. Onlara başqa möcüzə lazım deyil. Həmin Qurani-Şərif kifayət edər.**

**110) (وَنُقَلِّبُ أَفْئِدَتَهُمْ وَأَبْصَارَهُمْ) – onların öz əməllərinə görə qəlblərini və gözlərini dəyişdirərik. Ta ki haqdan** (Qurandan) **bir şey görüb dərk etməsinlər. (كَمَا لَمْ يُؤْمِنُوا بِهِ أَوَّلَ مَرَّةٍ) – necə ki əvvəlcə nazil olanda Qurana iman gətirmədilər, indi də iman gətirməzlər. (وَنَذَرُهُمْ فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ) – onları küfr və şirklərində tərk edib elə bir halətdə qoyarıq ki, sərgərdan qalıb heç bir tərəfə yol tapa bilməzlər.**

**111) (وَلَوْ أَنَّنَا نَزَّلْنَا إِلَيْهِمُ الْمَلَائِكَةَ)** – (ey Məhəmməd)**, əgər biz bu müşriklərə möcüzə üçün mələklər göndərsək,** (Necə ki özləri istəyib deyirdilər: "Bizə Allah-Təala möcüzə göndərsin, ondan sonra iman gətirək"), **(وَكَلَّمَهُمُ الْمَوْتَى) – o ölülər dirilib onlarla danışsa,** (necə ki dedilər: "Bizim keçən ata-babalarımızı dirildib, gəlib bizlə danışsınlar"). **(وَحَشَرْنَا عَلَيْهِمْ كُلَّ شَيْءٍ قُبُلًا) – və hər bir şeyi cəm edib gətirsək, ta ki sənin və Quranın haqq olmağına şahid olub şəhadət etsinlər,** (necə ki dedilər: Allah-Təala və mələklər gəlib sənin doğru olmağına şəhadət etsinlər, ondan sonra iman gətirək), **(مَا كَانُوا لِيُؤْمِنُوا إِلَّا أَنْ يَشَاءَ اللَّهُ) – əgər müşriklərdən ötrü bu möcüzələrin hər birini gətirsək də, Allah-Təala istəmədikcə, iman gətirməzlər, ancaq Allah-Təala özü istəsə, onları zorla imana daxil edər. Bunu da Allah-Təala istəmir. (وَلَكِنَّ أَكْثَرَهُمْ يَجْهَلُونَ) – lakin onların çoxu cahildir, cəhalətdən sənə qarşı çıxıb, iman gətirmirlər, əgər elm sahibi olsaydılar, iman gətirərdilər.**

**112) (وَكَذَلِكَ جَعَلْنَا لِكُلِّ نَبِيٍّ عَدُوًّا شَيَاطِينَ الْإِنْسِ وَالْجِنِّ)** – (ey Məhəmməd)**, necə ki sənin düşmənin vardır, habelə səndən qabaq keçən peyğəmbərlərdən ötrü də insan və cinin şeytanlarından - Allah-Təalanın itaətindən kənar**

يُوحِي بَعْضُهُمْ إِلَى بَعْضٍ زُخْرُفَ الْقَوْلِ غُرُورًا وَلَوْ شَاءَ رَبُّكَ مَا فَعَلُوهُ فَذَرْهُمْ وَمَا يَفْتَرُونَ ﴿١١٢﴾
وَلِتَصْغَى إِلَيْهِ أَفْئِدَةُ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْآخِرَةِ وَلِيَرْضَوْهُ وَلِيَقْتَرِفُوا مَا هُمْ مُقْتَرِفُونَ ﴿١١٣﴾ أَفَغَيْرَ
اللَّهِ أَبْتَغِي حَكَمًا وَهُوَ الَّذِي أَنْزَلَ إِلَيْكُمُ الْكِتَابَ مُفَصَّلًا وَالَّذِينَ آتَيْنَاهُمُ الْكِتَابَ يَعْلَمُونَ أَنَّهُ مُنَزَّلٌ
مِنْ رَبِّكَ بِالْحَقِّ فَلَا تَكُونَنَّ مِنَ الْمُمْتَرِينَ ﴿١١٤﴾

---

**olanlardan düşmənlər yaratdıq,** (itaətdən çıxana şeytan deyilir, həmin surənin bundan sonra gələn 130-cu ayəsindən məlum olur ki, cinlər dünyada bir tayfa olubdur. Onların özlərindən olan peyğəmbəri olubdur, buna görə bu ayənin mənası belədir. İnsanların peyğəmbərlərinə insan şeytanlarından, cinlərin peyğəmbərlərinə cin şeytanlarından düşmən yaratdıq. Bu şəkildə ayənin mənasında ziddiyyət, şübhə yoxdur. Ya da ki cindən məqsəd bədəvilər, insandan məqsəd şəhər əhlidir, təfəkkür edin). **(يُوحِي بَعْضُهُمْ إِلَى بَعْضٍ زُخْرُفَ الْقَوْلِ غُرُورًا) – insan və cin şeytanlarının bəzisi digərlərinə ziynətli və məğrur edən, aldadıcı sözlər çatdırarlar. (وَلَوْ شَاءَ رَبُّكَ مَا فَعَلُوهُ)** – (ey Məhəmməd)**, əgər sənin rəbbin Allah-Təala istəsə, peyğəmbərlərə düşmənçilik edə bilməzlər. (فَذَرْهُمْ وَمَا يَفْتَرُونَ)** – (ey Məhəmməd)**, bu müşrikləri iftira etdikləri şeylərlə birlikdə tərk edib onlardan üz döndər, Allah-Təala onlara cəza verəcəkdir.**

**113) (وَلِتَصْغَى إِلَيْهِ أَفْئِدَةُ الَّذِينَ لَا يُؤْمِنُونَ بِالْآخِرَةِ) – peyğəmbərlərə qarşı ədavətə və şeytanın vəsvəsəsinə axirətə iman gətirməyən şəxslər qulaq asıb itaət edər. (وَلِيَرْضَوْهُ)** – (ey Məhəmməd)**, qoy bu müşriklər batil sözlərə və şeytanın vəsvəsəsinə razı olub peyğəmbərlərə düşmənçilik etsinlər. (وَلِيَقْتَرِفُوا مَا هُمْ مُقْتَرِفُونَ) – nə qədər günah qazanırlarsa, qoy qazansınlar, bu əməllərə görə onlardan intiqam alıb, hamısının cəzasını onlara verəcəyəm.**

**114) (أَفَغَيْرَ اللَّهِ أَبْتَغِي حَكَمًا)** – (ey Məhəmməd)**, müşriklərə de: bəs Allah-Təaladan başqa bir hakim axtarıb tapım ki, mənimlə sizin aranızda hökm etsin ki, haqla batil bir-birindən aralanıb məlum olsun?** (Allah-Təaladan başqa mənə hakim lazım deyil). **(وَهُوَ الَّذِي أَنْزَلَ إِلَيْكُمُ الْكِتَابَ مُفَصَّلًا) – necə ola bilər ki, mən Allah-Təaladan başqa hakim tapım, halbuki haqla batilin fərqinin bəyan olunduğu kitabı** (Quranı) **Allah-Təala sizə göndəribdir. (وَالَّذِينَ آتَيْنَاهُمُ الْكِتَابَ يَعْلَمُونَ أَنَّهُ مُنَزَّلٌ مِنْ رَبِّكَ بِالْحَقِّ)** – (ey Məhəmməd), **de: Allah-Təala mənə o şəxsləri xəbər verir ki, sizdən qabaq onlara** (yəhudi və xristianlara) **kitab göndərmişik, bu Quranın haqq olduğuna sənin rəbbin Allah-Təala tərəfindən agahdırlar, gedin onlardan soruşun, əgər gizlətsələr, şəhadəti gizləmiş olarlar. (فَلَا تَكُونَنَّ مِنَ الْمُمْتَرِينَ)** – (ey Məhəmməd)**, əlbəttə, sən öz işində şəkk və şübhə içində olma.** (Bu kəlam müsəlmanları Qurandan möhkəm yapışmağa təşviq etməkdən ötrüdür, yoxsa necə ola bilər ki, xalqı Qurana dəvət edən şəxsin özünün ona şəkki olsun).

وَتَمَّتْ كَلِمَةُ رَبِّكَ صِدْقًا وَعَدْلًا لَا مُبَدِّلَ لِكَلِمَاتِهِ وَهُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿١١٥﴾ وَإِنْ تُطِعْ أَكْثَرَ مَنْ
فِي الْأَرْضِ يُضِلُّوكَ عَنْ سَبِيلِ اللَّهِ إِنْ يَتَّبِعُونَ إِلَّا الظَّنَّ وَإِنْ هُمْ إِلَّا يَخْرُصُونَ ﴿١١٦﴾ إِنَّ رَبَّكَ هُوَ
أَعْلَمُ مَنْ يَضِلُّ عَنْ سَبِيلِهِ وَهُوَ أَعْلَمُ بِالْمُهْتَدِينَ ﴿١١٧﴾ فَكُلُوا مِمَّا ذُكِرَ اسْمُ اللَّهِ عَلَيْهِ

---

**115) (وَتَمَّتْ كَلِمَةُ رَبِّكَ صِدْقًا وَعَدْلًا)** –(ey Məhəmməd), **sənin rəbbin Allah-Təalanın sözləri doğruluq və ədalət üzrə tamam olub onda heç bir nöqsan yoxdur. (لَا مُبَدِّلَ لِكَلِمَاتِهِ) – heç bir şəxs Allah-Təalanın sözlərini dəyişdirib, ondan daha doğru və ədalətli söz deməyə qadir olmaz. (وَهُوَ السَّمِيعُ الْعَلِيمُ) – xalqın əməllərini eşidən və agah olan Allah-Təaladır.**

**116) (وَإِنْ تُطِعْ أَكْثَرَ مَنْ فِي الْأَرْضِ)** – (ey Məhəmməd), **əgər sən yer üzündə olan məxluqatın çoxunun sözlərinə qulaq asıb itaət etsən, (يُضِلُّوكَ عَنْ سَبِيلِ اللَّهِ) – o vaxt səni Allah-Təala yolundan kənara salıb zəlalətə salarlar. Necə ki özləri zəlalətdədirlər. (إِنْ يَتَّبِعُونَ إِلَّا الظَّنَّ) – çünki xalqın əksəriyyəti nəfsani arzularla öz zənlərinə tabe olub ata-babaları gedən yolu haqq bilib onları təqlid edirlər. O səbəbdən həmişə o fikirdədirlər ki, səni də özləriylə həmdin etsinlər. Əlbəttə, sən onlardan kənar olub ata-babanı təqlid etməyi unudub, Haqqdan sənə vəhy olunan sözlərə tabe ol. (وَإِنْ هُمْ إِلَّا يَخْرُصُونَ) – xalqın* əksəriyyəti zənn və təxminlə özlərindən ötrü din və məzhəb ixtira edib Allah-Təalanın sözlərini kənara qoyub öz nəfsani istəklərinə tabe olurlar.**

*(****Qeyd:*** Sanki, bu kəlam bizim zəmanəmizdən ötrü nazil olubdur, islama mənsub olanlara baxıb görürsən ki, hər biri özündən ötrü bir məzhəb və bir təriqət seçib, Qurani-Şərifdən üz döndəriblər. Əgər onlara Qurani-Şərifin ayələrini bəyan etsən, rəylərinə müvafiq olanı alıb, digərlərini tərk edərlər. Bunun bütün təqsiri ruhanilərin rəhbərlərindədir ki, hər biri özündən ötrü avam aldadan bir yol seçib, onunla avam insanları ətrafına yığıb, o biçarələri cəhalət qaranlığında çaşqın və sərgərdan qoyublar. Onların fitvalarına görə, məsələn, bir evdə iki qardaşdan birinin bişirdiyi yeməyi biri pak bilib, o birisi murdar hesab etsə, o qardaşın özündən və bütün əşyalarından çəkinər. Allahım, bu nə din, nə məzhəb, bu nə cəhalətdir? Müsəlmanlar kimi parçalanmış bir ümmət yer üzündə varmı? İlahi, sən özün bunları əsl islam dininə qaytar!)*

**117) (إِنَّ رَبَّكَ هُوَ أَعْلَمُ مَنْ يَضِلُّ عَنْ سَبِيلِهِ)** – (ey Məhəmməd), **həqiqətən, sənin rəbbin Allah-Təala yolundan kənara düşüb zəlalətdə qalan şəxsin əhvalından agahdır. (وَهُوَ أَعْلَمُ بِالْمُهْتَدِينَ) – yenə Allah-Təala hidayət tapan, zəlalətdən kənar olub haqqa vasil olan şəxsləri bilir.**

**118) (فَكُلُوا مِمَّا ذُكِرَ اسْمُ اللَّهِ عَلَيْهِ)** – (bu ayədə qurban kəsərkən Allah-Təalanın adının zikr olunmasının vacib olduğu bəyan edilir)**. Əti yeyilən o heyvanlar ki, kəsilən zaman Allahın adı zikr olunub, onların ətindən yeyin. Ondan başqa, heç bir heyvanın ətindən yeməyin. (Müşriklər müsəlmanlara**

إِنْ كُنْتُمْ بِآيَاتِهِ مُؤْمِنِينَ ﴿١١٨﴾ وَمَا لَكُمْ أَلَّا تَأْكُلُوا مِمَّا ذُكِرَ اسْمُ اللَّهِ عَلَيْهِ وَقَدْ فَصَّلَ لَكُمْ مَا حَرَّمَ
عَلَيْكُمْ إِلَّا مَا اضْطُرِرْتُمْ إِلَيْهِ وَإِنَّ كَثِيرًا لَيُضِلُّونَ بِأَهْوَائِهِمْ بِغَيْرِ عِلْمٍ إِنَّ رَبَّكَ هُوَ أَعْلَمُ بِالْمُعْتَدِينَ
﴿١١٩﴾ وَذَرُوا ظَاهِرَ الْإِثْمِ وَبَاطِنَهُ إِنَّ الَّذِينَ يَكْسِبُونَ الْإِثْمَ سَيُجْزَوْنَ بِمَا كَانُوا يَقْتَرِفُونَ ﴿١٢٠﴾
وَلَا تَأْكُلُوا مِمَّا لَمْ يُذْكَرِ اسْمُ اللَّهِ عَلَيْهِ وَإِنَّهُ لَفِسْقٌ وَإِنَّ الشَّيَاطِينَ لَيُوحُونَ إِلَى أَوْلِيَائِهِمْ لِيُجَادِلُوكُمْ
وَإِنْ أَطَعْتُمُوهُمْ إِنَّكُمْ لَمُشْرِكُونَ ﴿١٢١﴾

---

**dedilər: “Siz ki Allah-Təalaya ibadət edirsiniz, gərək, Allah-Təalanın öldürdüyü heyvanın ətindən yeyəsiniz, nəinki özünüzün öldürdüyü heyvandan, o vaxt bu ayə nazil oldu). (إِنْ كُنْتُمْ بِآيَاتِهِ مُؤْمِنِينَ) – əgər Allah-Təalanın ayə və ehkamlarına iman gətirənsinizsə, gərək, Allah-Təalanın adı zikr olunan heyvanın ətindən başqa, heç bir heyvanın ətindən yeməyəsiniz.**

**119) (وَمَا لَكُمْ أَلَّا تَأْكُلُوا مِمَّا ذُكِرَ اسْمُ اللَّهِ عَلَيْهِ) – nə məqsədiniz var ki, Allah-Təalanın adı zikr olunaraq kəsilən heyvanın ətini yemirsiniz? Həmin heyvanın ətindən, gərək, yeyəsiniz, çünki o sizə haram olunmayıbdır. (Ondan başqa, heyvanın əti sizə haram olunubdur). (وَقَدْ فَصَّلَ لَكُمْ مَا حَرَّمَ عَلَيْكُمْ) – halbuki həqiqətən, Allah-Təala sizdən ötrü o şeyləri haram edibdir ki, onları bu Qurani-Şərifdə təfsilatı ilə bəyan edibdir. Allah-Təalanın adı zikr olunaraq kəsilən heyvan haram sayılmayıbdır. Onun ətindən başqa, haram olunan heyvanların ətindən yeyə bilməzsiniz. (إِلَّا مَا اضْطُرِرْتُمْ إِلَيْهِ) – ancaq naəlac qalsanız, zərurət məqamında o vaxt yemək caizdir. (وَإِنَّ كَثِيرًا لَيُضِلُّونَ بِأَهْوَائِهِمْ بِغَيْرِ عِلْمٍ) – həqiqətən, əlbəttə, xalqın əksəriyyəti zəlalətə vaqe olub, nəfsani istəkləri ilə elmləri olmadan halalı haram, haramı halal edirlər. (إِنَّ رَبَّكَ هُوَ أَعْلَمُ بِالْمُعْتَدِينَ) –** (ey Məhəmməd), **həqiqətən, sənin rəbbin hədlərini aşıb haramı halal, halalı haram edən şəxslərdən agahdır, əməllərinin cəzasını onlara verəcəkdir.**

**120) (وَذَرُوا ظَاهِرَ الْإِثْمِ وَبَاطِنَهُ) – aşkarda və gizlində etdiyiniz günahları tərk edin. Aşkar və gizlin hər ikisindən Allah-Təala agahdır. (إِنَّ الَّذِينَ يَكْسِبُونَ الْإِثْمَ سَيُجْزَوْنَ بِمَا كَانُوا يَقْتَرِفُونَ) – həqiqətən, o şəxslər ki aşkarda və gizlində günah qazanıb, Allah-Təalanın haram etdiyi şeyləri yeyir, əlbəttə, onlara qazandıqları günahın cəzasını verəcəkdir.**

**121) (وَلَا تَأْكُلُوا مِمَّا لَمْ يُذْكَرِ اسْمُ اللَّهِ عَلَيْهِ وَإِنَّهُ لَفِسْقٌ) – kəsilən vaxt Allah-Təalanın adı zikr olunmayan heyvanın ətindən yeməyin. Həqiqətən, o heyvanın ətini yemək pis əməldir. O şəxs onun səbəbinə günahkar olub fasiqlər cərgəsinə mənsub olar. (وَإِنَّ الشَّيَاطِينَ لَيُوحُونَ إِلَى أَوْلِيَائِهِمْ لِيُجَادِلُوكُمْ) – həqiqətən, şeytanlar öz dostları müşriklərə vəsvəsə edirlər ki, sizinlə münaqişə və mübahisə etsinlər ki, nədən ötrü siz Allah-Təalanın öldürdüyü heyvanın ətindən yemirsiniz? (وَإِنْ أَطَعْتُمُوهُمْ إِنَّكُمْ لَمُشْرِكُونَ) – əgər müşriklərə* itaət edib**

أَوَمَنْ كَانَ مَيْتًا فَأَحْيَيْنَاهُ وَجَعَلْنَا لَهُ نُورًا يَمْشِي بِهِ فِي النَّاسِ كَمَنْ مَثَلُهُ فِي الظُّلُمَاتِ لَيْسَ بِخَارِجٍ
مِنْهَا كَذَلِكَ زُيِّنَ لِلْكَافِرِينَ مَا كَانُوا يَعْمَلُونَ ﴿١٢٢﴾ وَكَذَلِكَ جَعَلْنَا فِي كُلِّ قَرْيَةٍ أَكَابِرَ مُجْرِمِيهَا
لِيَمْكُرُوا فِيهَا

---

**Allah-Təalanın adı zikr olunmadan kəsilən heyvanın ətindən yesəniz, həqiqətən, o zaman siz də müşriksiniz.**

*(*****Qeyd:*** *Kim dini ehkamda Allah-Təaladan başqasına tabe olsa, həqiqətən, Allah-Təalaya şərik qoşmuş olar. Bir çox müsəlman bu ayənin ehtivasına daxil olub müşriklərdən hesab olunar. Vay olsun bizə, Qurani-Şərifi ölü üstündə oxumağa həsr edib özümüzdən təzə bir din və ayin düzəltmişik. Əgər Qurani-Şərifə dürüst diqqət etsən, bizim aramızda olan dini qanunların tamamən Qurana zidd olduğunu görərsən. Ey Peyğəmbər, kaş həyatda olaydın, baxıb görəydin ki, sənin bu pak olan müqəddəs dininə nə dəyişikliklər ediblər. Nə gözəl deyir şeyx Nizami Gəncəvi:*

*Ey Məkkə, Mədinənin pərdələnən günəşi,*
*Zülmət pərdələyərmi nur ələyən günəşi?!*
*Torpağının ətrindən ətir saçandı yurdun.*
*Fitnə, nifaq qoxuyur sənsiz haçandı yurdun.*
*Harınların əlindən bu taxtı al geri sən,*
*Alçaqlar ləkələdi, təmizlə minbəri sən.*
*Cin-şeytan yuvasına döndərdilər dünyanı,*
*Qoy zalımın, namərdin yerdə çürüsün canı.*

*Şeyx Nizami h. 500–cü ildə bu şikayəti edib, o vaxtdan h. 1320-ci ilə kimi islamda nə qədər dəyişiklik olubdur, bu mətləb bəsirət əhlinə məxfi deyildir).*

**122) (أَوَمَنْ كَانَ مَيْتًا فَأَحْيَيْنَاهُ) – bəs o şəxs ki, küfrlə öldüyü halda, onu iman səbəbinə dirildək, (وَجَعَلْنَا لَهُ نُورًا يَمْشِي بِهِ فِي النَّاسِ) – və ondan ötrü iman nuru verək ki, xalqın arasında o nurla yol gedib, hidayəti zəlalətdən fərqləndirsin, (كَمَنْ مَثَلُهُ فِي الظُّلُمَاتِ لَيْسَ بِخَارِجٍ مِنْهَا) – bu qeyd olunan şəxs cəhalət və küfr qaranlığında qalıb heç vaxt oradan çıxa bilməyən şəxs kimi olarmı?** (Bu ayə möminlə kafirin və müşrikin halından ötrü bir məsəldir), **(كَذَلِكَ زُيِّنَ لِلْكَافِرِينَ مَا كَانُوا يَعْمَلُونَ) – necə ki qeyd olundu, şeytan kafirlərə əməllərini gözəl göstərib, o səbəbə görə küfr və şirk qaranlığında qalıb iman tərəfinə çıxmırlar.**

**123) (وَكَذَلِكَ جَعَلْنَا فِي كُلِّ قَرْيَةٍ أَكَابِرَ مُجْرِمِيهَا)** – (ey Məhəmməd), **necə ki Məkkədə bir çox varlı şəxslər xalqın iman gətirməsinə mane olurlar, habelə sizdən qabaq keçən peyğəmbərlərin zamanında da hər bir qəsəbədəki başçıları onların günahkarlarından təyin etdik ki, (لِيَمْكُرُوا فِيهَا) – məkr və hiylə edib xalqın iman gətirməsinə mane olsunlar. O fasiqlərə belə bir ixtiyar verdik ki, görək xalq onların sözlərinə qulaq asır, yoxsa onların sözlərini zəif**

وَمَا يَمْكُرُونَ إِلَّا بِأَنْفُسِهِمْ وَمَا يَشْعُرُونَ ﴿١٢٣﴾ وَإِذَا جَاءَتْهُمْ آيَةٌ قَالُوا لَنْ نُؤْمِنَ حَتَّى نُؤْتَى مِثْلَ
مَا أُوتِيَ رُسُلُ اللهِ اللَّهُ أَعْلَمُ حَيْثُ يَجْعَلُ رِسَالَتَهُ سَيُصِيبُ الَّذِينَ أَجْرَمُوا صَغَارٌ عِنْدَ اللهِ وَعَذَابٌ
شَدِيدٌ بِمَا كَانُوا يَمْكُرُونَ ﴿١٢٤﴾ فَمَنْ يُرِدِ اللَّهُ أَنْ يَهدِيَهُ يَشْرَحْ صَدْرَهُ لِلْإِسْلَامِ وَمَنْ يُرِدْ أَنْ
يُضِلَّهُ يَجْعَلْ صَدْرَهُ ضَيِّقًا حَرَجًا كَأَنَّمَا يَصَّعَّدُ فِي السَّمَاءِ كَذَلِكَ يَجْعَلُ اللهُ الرِّجْسَ عَلَى الَّذِينَ
لَا يُؤْمِنُونَ ﴿١٢٥﴾

---

**olan yel kimi hesab edib, Allah-Təalanın tərəfinə gedib imana daxil olurlar? (وَمَا يَمْكُرُونَ إِلَّا بِأَنْفُسِهِمْ) – onların etdiyi məkr və hiylənin günahı, cəzası ancaq özlərinə aid olacaqdır. (وَمَا يَشْعُرُونَ) – amma bilmirlər ki, onun günah və cəzası özlərinə aid olacaqdır. Belə xəyal edirlər ki, bu məkr və hiylədən onlara heç bir zərər gəlməz.** (Əbu Cəhl dedi: “Ona vəhy gəldiyi kimi bizə də vəhy gəlmədikcə heç vaxt Məhəmmədə iman gətirmərik. O zaman sıradakı ayə nazil oldu).

**124) (وَإِذَا جَاءَتْهُمْ آيَةٌ) – o zaman ki Məkkə əhli Qüreyşə Allah-Təala tərəfindən bir möcüzə gəldi, (قَالُوا لَنْ نُؤْمِنَ) – dedilər: (ey Məhəmməd, biz heç vaxt sənə iman gətirmərik (حَتَّى نُؤْتَى مِثْلَ مَا أُوتِيَ رُسُلُ اللهِ) – ki, Allah-Təala bizə də öz peyğəmbərlərinə verdiyi o möcüzələrin və kəlamların bənzərini versin. O vaxt biz də iman gətirərik. (اللَّهُ أَعْلَمُ حَيْثُ يَجْعَلُ رِسَالَتَهُ) –** (ey Məhəmməd)**, onların cavabında de: Allah-Təala hansı şəxsə peyğəmbərlik verib göndərəcəyinə agahdır. Heç kim öz xahişi ilə peyğəmbər ola bilməz. (سَيُصِيبُ الَّذِينَ أَجْرَمُوا صَغَارٌ عِنْدَ اللهِ) – o şəxslər ki Allah-Təalaya asi olublar, dünyada onlara son dərəcə zillət yetişər. Allah-Təala yanında zəlil olmaq onlardan ötrü sabitdir. Gərək** (o zillət) **onlara yetişsin. (وَعَذَابٌ شَدِيدٌ بِمَا كَانُوا يَمْكُرُونَ) – o səbəbə görə ki, onlar məkr və hiylə edib xalqın Allah-Təalaya iman gətirməsinə mane olurlar, onlardan ötrü axirətdə də şiddətli əzab vardır.**

**125) (فَمَنْ يُرِدِ اللَّهُ أَنْ يَهدِيَهُ) – kim hidayətə qabil olub Allah-Təala onun hidayət etməsini istəsə, (يَشْرَحْ صَدْرَهُ لِلْإِسْلَامِ) – ona lütf edib islama daxil olması üçün qəlbini açar ki, islam nuru onun qəlbinə daxil olub dində sabit və bərqərar olsun. (وَمَنْ يُرِدْ أَنْ يُضِلَّهُ) – kim hidayətə qabil olmayıb, Allah-Təala belə şəxsi öz ixtiyarına həvalə edib küfrdə qalmasını istəsə, (يَجْعَلْ صَدْرَهُ ضَيِّقًا حَرَجًا) – elə şəxsin qəlbini dar və sərt edib, onun qəlbi möhkəm bağlanar. Heç vaxt onun qəlbinə iman daxil olmaz. (كَأَنَّمَا يَصَّعَّدُ فِي السَّمَاءِ) – onun imana gəlməsi, sanki, səmaya yüksəlmək istəməsi kimidir.** (Necə ki səmaya çıxmaq mümkün deyil, imana daxil olmağı ona təklif etmək də səmaya çıxmağı ona təklif etmək kimidir). **(كَذَلِكَ يَجْعَلُ اللهُ الرِّجْسَ عَلَى الَّذِينَ لَا يُؤْمِنُونَ) – Allah-Təala dünyada və axirətdə iman gətirməyən şəxslərə belə əzab edər.**

**وَهَذَا صِرَاطُ رَبِّكَ مُسْتَقِيمًا قَدْ فَصَّلْنَا الْآَيَاتِ لِقَوْمٍ يَذَّكَّرُونَ ﴿١٢٦﴾ لَهُمْ دَارُ السَّلَامِ عِنْدَ رَبِّهِمْ وَهُوَ وَلِيُّهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ ﴿١٢٧﴾ وَيَوْمَ يَحْشُرُهُمْ جَمِيعًا يَا مَعْشَرَ الْجِنِّ قَدِ اسْتَكْثَرْتُمْ مِنَ الْإِنْسِ وَقَالَ أَوْلِيَاؤُهُمْ مِنَ الْإِنْسِ رَبَّنَا اسْتَمْتَعَ بَعْضُنَا بِبَعْضٍ وَبَلَغْنَا أَجَلَنَا الَّذِي أَجَّلْتَ لَنَا قَالَ النَّارُ مَثْوَاكُمْ خَالِدِينَ فِيهَا إِلَّا مَا شَاءَ اللَّهُ**

---

**126) (وَهَذَا صِرَاطُ رَبِّكَ مُسْتَقِيمًا)** – (ey Məhəmməd)**, bu qeyd olunan yol (qabil olana hidayət etmək, qabil olmayanı zəlalətdə saxlamaq) sənin rəbbin Allah-Təalanın yoludur. Hikmət üzrə bu yolu seçibdir. (قَدْ فَصَّلْنَا الْآَيَاتِ لِقَوْمٍ يَذَّكَّرُونَ) – həqiqətən, bu Qurani-Şərifin ayələrini agah olub öyüd-nəsihət qəbul edən camaatdan*ötrü təfsilatı ilə bəyan etdik.**

*(***Qeyd:** İlahi, öyüd-nəsihətə qulaq asan varmı? Müsəlmanlar Qurani-Şərifin nəsihətlərini və ehkamını qəbul etsələr, belə sərgərdan qalıb başqa ehkam və qanun axtararlarmı? Halbuki heç bir qanun Qurani-Şərifin qanununa çata bilməz. Qurani-Şərif bu zamanda müsəlmanlar arasında gövhər kimi olan sözlərinə etina edilməyən qərib bir şəxs kimidir. Amma Quran indi hiyləbazlıq edib, dünya malı əldə etməkdən başqa, bir şeyə lazım deyildir. "Onu az olan bir məbləğə satarlar" ayəsi bizim zamanımıza uyğundur. Ar olsun müsəlmanlara!)*

**127) (لَهُمْ دَارُ السَّلَامِ عِنْدَ رَبِّهِمْ) – nəsihət qəbul edən şəxslərdən ötrü axirətdə öz rəblərinin yanında elə əmin-amanlıq evi vardır ki, o evdə bütün bəla və kədərlərdən əmin olarlar. (وَهُوَ وَلِيُّهُمْ بِمَا كَانُوا يَعْمَلُونَ) – onların yaxşı əməllərinin səbəbinə onların dostu və köməyi Allah-Təaladır.**

**128) (وَيَوْمَ يَحْشُرُهُمْ جَمِيعًا)** – (ey Məhəmməd), **qiyamət gününü yadına sal ki, o gün bütün məxluqatı bir yerə toplayarıq. (يَا مَعْشَرَ الْجِنِّ) – o gün cin tayfasının itaətdən çıxanlarına və şeytanlarına da deyərik: (قَدِ اسْتَكْثَرْتُمْ مِنَ الْإِنْسِ) – "Özgə insanlardan bir çoxunu özünüzə tabe edib, zəlalətə saldınız". (وَقَالَ أَوْلِيَاؤُهُمْ مِنَ الْإِنْسِ) – cinlərin insanlardan olan dostları cavab verib dedilər: (رَبَّنَا اسْتَمْتَعَ بَعْضُنَا بِبَعْضٍ) – "Ey bizim rəbbimiz, bizi cinlər zəlalətə saldı, bir-birimizdən faydalanıb ləzzət aldıq. Biz onlara tabe olmaqla dünya ləzzəti aldığımız üçün mənfəət əldə etdik. Onlar da bizə rəhbərlik etməklə mənfəət əldə etdilər".** (Hər şəxsin içində bir şeytan vardır, hünərli şəxs odur ki, öz şeytanını itaət etdirsin). **(وَبَلَغْنَا أَجَلَنَا الَّذِي أَجَّلْتَ لَنَا) – yenə dedilər: "Ey bizim rəbbimiz, bizim üçün təyin etdiyin o müəyyən vaxt** (qiyamət günü) **ki, biz onu inkar edirdik, ona yetişdik". (قَالَ النَّارُ مَثْوَاكُمْ خَالِدِينَ فِيهَا) – Allah-Təala onların cavabında buyurur: "Cəhənnəmin odu sizin mənzil və məkanınızdır. Orada həmişəlik qalacaqsınız. (إِلَّا مَا شَاءَ اللَّهُ) – Ancaq Allah-Təalanın istəyi istisna olmaqla həmişə od əzabında olacaqsınız. İstəsə, sizi od əzabından çıxarıb, şiddətli soyuqluq əzabına düçar edər".** (Cəhənnəm əhlini bəzən cəhənnəmdən çıxarıb, soyuq olan biyabana aparարlar, onlar ora-

إِنَّ رَبَّكَ حَكِيمٌ عَلِيمٌ ﴿١٢٨﴾ وَكَذَلِكَ نُوَلِّي بَعْضَ الظَّالِمِينَ بَعْضًا بِمَا كَانُوا يَكْسِبُونَ ﴿١٢٩﴾
يَا مَعْشَرَ الْجِنِّ وَالْإِنْسِ أَلَمْ يَأْتِكُمْ رُسُلٌ مِنْكُمْ يَقُصُّونَ عَلَيْكُمْ آيَاتِي وَيُنْذِرُونَكُمْ لِقَاءَ يَوْمِكُمْ هَذَا
قَالُوا شَهِدْنَا عَلَى أَنْفُسِنَا وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا وَشَهِدُوا عَلَى أَنْفُسِهِمْ أَنَّهُمْ كَانُوا كَافِرِينَ ﴿١٣٠﴾
ذَلِكَ أَنْ لَمْ يَكُنْ رَبُّكَ مُهْلِكَ الْقُرَى بِظُلْمٍ وَأَهْلُهَا غَافِلُونَ ﴿١٣١﴾ وَلِكُلٍّ دَرَجَاتٌ مِمَّا عَمِلُوا وَمَا
رَبُّكَ بِغَافِلٍ عَمَّا يَعْمَلُونَ ﴿١٣٢﴾

---

da fəryad edib cəhənnəmə qayıtmağı xahiş edərlər). **(إِنَّ رَبَّكَ حَكِيمٌ عَلِيمٌ)** – (ey Məhəmməd), **həqiqətən, sənin rəbbin hikmət sahibidir. Hər bir əməli hikmət üzrədir və hər kəsin əhvalından agahdır.**

**129) (وَكَذَلِكَ نُوَلِّي بَعْضَ الظَّالِمِينَ بَعْضًا) – necə ki zalımlar dünyada şeytana tabe olub onları özlərinə dost tuturlar, həmçinin axirətdə də zalımlarla şeytanları bir-birilərinə dost etdik ki, əzabda bir yerdə olub bir-birilərindən kənar olmasınlar, (بِمَا كَانُوا يَكْسِبُونَ) – o pis və xəbis əməllərə görə ki, dünyada onları edib özlərindən ötrü qazanmışdılar.**

**130) (يَا مَعْشَرَ الْجِنِّ وَالْإِنْسِ)** – (qiyamət günündə Allah-Təala cin və insanlara xitab edib buyurur:) **ey cin və insan topluluğu, (أَلَمْ يَأْتِكُمْ رُسُلٌ مِنْكُمْ) – bəs sizə öz cinsinizdən bizim tərəfimizdən peyğəmbər gəlmədimi?** (Yəni siz cinlərə cindən və siz insanlara insandan peyğəmbər gəlmədimi?) **Bəs nəyə görə, inkar edib itaət etmədiniz? (يَقُصُّونَ عَلَيْكُمْ آيَاتِي) – o peyğəmbərlər gəlib mənim ayə və ehkamlarımı sizə xəbər verdilər. (وَيُنْذِرُونَكُمْ لِقَاءَ يَوْمِكُمْ هَذَا) – bugünkü günlə** (qiyamət günü ilə) **qarşılaşmaqla və onun əzabı ilə sizi qorxudurdular. (قَالُوا شَهِدْنَا عَلَى أَنْفُسِنَا)** – (Allah-Təala buyurur: biz onlara bu xitabı edəndə onlar cavab verib dedilər:) **ilahi, öz əleyhimizə şəhadət edirik ki, bizə peyğəmbər gəlib bizi haqqın tərəfinə dəvət etdi. Amma biz ona itaət etmədik. (وَغَرَّتْهُمُ الْحَيَاةُ الدُّنْيَا)** – (ey Məhəmməd), **onları dünya həyatı elə məğrur edib aldatdı ki, dünyada həmişəlik qalacaqlarını xəyal etdilər. Daha peyğəmbərlərə itaət etmədilər. (وَشَهِدُوا عَلَى أَنْفُسِهِمْ أَنَّهُمْ كَانُوا كَافِرِينَ) – və qiyamət günündə özlərinin əleyhinə şəhadət edərlər ki, həqiqətən, dünyada kafir olan şəxslər idilər.**

**131) (ذَلِكَ أَنْ لَمْ يَكُنْ رَبُّكَ مُهْلِكَ الْقُرَى بِظُلْمٍ)** – (ey Məhəmməd), **cin və insanlara peyğəmbər göndərmək o səbəbə görədir ki, həqiqətən, sənin rəbbin Allah-Təala bir qəsəbənin əhlini o halda etdikləri zülmə görə həlak edən deyil ki, (وَأَهْلُهَا غَافِلُونَ) – o qəsəbənin əhli qafil olub onlara bir peyğəmbər və bir kitab gəlməyibdir. Allah-Təala heç bir qövmə peyğəmbər və kitab göndərmədikcə, əzab etməz, elə ki itaətdən çıxdılar, ondan sonra əzab edər.**

**132) (وَلِكُلٍّ دَرَجَاتٌ مِمَّا عَمِلُوا) –hər bir şəxsdən ötrü öz əməlinə görə axirətdə dərəcələr və mənzillər vardır. (وَمَا رَبُّكَ بِغَافِلٍ عَمَّا يَعْمَلُونَ)** – (ey Məhəmməd), **sə-**

وَرَبُّكَ الْغَنِيُّ ذُو الرَّحْمَةِ إِنْ يَشَأْ يُذْهِبْكُمْ وَيَسْتَخْلِفْ مِنْ بَعْدِكُمْ مَا يَشَاءُ كَمَا أَنْشَأَكُمْ مِنْ ذُرِّيَّةِ قَوْمٍ
آخَرِينَ ﴿١٣٣﴾ إِنَّ مَا تُوعَدُونَ لَآتٍ وَمَا أَنْتُمْ بِمُعْجِزِينَ ﴿١٣٤﴾ قُلْ يَا قَوْمِ اعْمَلُوا عَلَى مَكَانَتِكُمْ
إِنِّي عَامِلٌ فَسَوْفَ تَعْلَمُونَ مَنْ تَكُونُ لَهُ عَاقِبَةُ الدَّارِ إِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ ﴿١٣٥﴾ وَجَعَلُوا لِلَّهِ مِمَّا
ذَرَأَ مِنَ الْحَرْثِ وَالْأَنْعَامِ نَصِيبًا فَقَالُوا هَذَا لِلَّهِ بِزَعْمِهِمْ وَهَذَا لِشُرَكَائِنَا

---

**nin rəbbin Allah-Təala etdiyiniz əməllərdən qafil olan deyildir.** (O əməllərinizin miqdarı və keyfiyyəti Allah-Təaladan ötrüdür, yoxsa yox, bunların heç biri Allah-Təalaya gizli qalmaz).

**133) (وَرَبُّكَ الْغَنِيُّ ذُو الرَّحْمَةِ)** - (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təala öz bəndələrinə və onların ibadətinə möhtac deyil. Bəndələrinə rəhmət sahibidir. Onlara məsuliyyət yükləyib ki, o təkliflərə əməl edib həmişəlik əcr və mənfəətə nail olsunlar. (إِنْ يَشَأْ يُذْهِبْكُمْ) - ey müşriklər, Allah-Təala istəsə, asi olan siz camaatı həlak edər. (وَيَسْتَخْلِفْ مِنْ بَعْدِكُمْ مَا يَشَاءُ) - sizdən sonra sizin yerinizə istədiyi başqa bir qövmü** (asi olmayan itaətkar camaatı) **gətirər. (كَمَا أَنْشَأَكُمْ مِنْ ذُرِّيَّةِ قَوْمٍ آخَرِينَ) - necə ki Allah-Təala sizi elə bir başqa camaatın nəslindən dünyaya gətirdi ki, onlar siz xüsusiyyətdə və əməldə deyildilər.** (Sizi Hz. Nuhun gəmisində olan camaatdan yaratdı, onların hamısı müvəhhid və mömin idilər), ola bilər ki, sizdən sonra da sizin nəslinizdən olan bir camaatı mömin və müvəhhid etsin. (Bu məsələ gerçək oldu, Məkkədə müşriklərin övladları müvəhhid və mömin olub onların yerinə məskun oldular).

**134) (إِنَّ مَا تُوعَدُونَ لَآتٍ) - həqiqətən, o şeylər ki, sizə vəd edilir,** (qiyamət gününün vaqe olması, yenidən dirilmək, haqq-hesab vermək, cənnət, cəhənnəm) **əlbəttə, hamısı vaqe olacaqdır. (وَمَا أَنْتُمْ بِمُعْجِزِينَ) - siz Allah-Təalanı aciz edib, onun qüdrətindən xilas olan deyilsiniz.**

**135) (قُلْ يَا قَوْمِ اعْمَلُوا عَلَى مَكَانَتِكُمْ إِنِّي عَامِلٌ)** - (ey Məhəmməd)**, müşriklərə de ki, ey müşriklər, siz öz qüdrət və imkanınıza görə nə ki arzu edirsiniz, ona əməl edin, mən də Allah-Təala mənə nə əmr edibdir, ona əməl edərəm. (فَسَوْفَ تَعْلَمُونَ مَنْ تَكُونُ لَهُ عَاقِبَةُ الدَّارِ) - tezliklə, öləndən sonra agah olacaqsınız ki, axirətdə xoşbəxtlik kimdən ötrüdür? (إِنَّهُ لَا يُفْلِحُ الظَّالِمُونَ) - həqiqətən, zalımlar nicat tapmazlar.** (Xoşbəxtlik zalım olmayan şəxslərə məxsusdur və ən böyük zülm Allah-Təalaya şərik qoşmaqdır)**.**

**136) (وَجَعَلُوا لِلَّهِ مِمَّا ذَرَأَ مِنَ الْحَرْثِ وَالْأَنْعَامِ نَصِيبًا) - müşriklər Allah-Təalanın yaratdığı şeylərdən - əkin və heyvanlardan Allah-Təala üçün bir pay müəyyənləşdirdilər. (فَقَالُوا هَذَا لِلَّهِ بِزَعْمِهِمْ) - dedilər: "Bu pay Allah-Təala üçündür," bu sözü öz kəlamlarıyla dedilər, halbuki Allah-Təala o payı əmr etməmişdi. (وَهَذَا لِشُرَكَائِنَا) - və bir hissə də müəyyənləşdirib dedilər: "Bu pay da bizim şəriklərimizindir".** (Məkkə əhli öz heyvanlarından və əkinlərindən

فَمَا كَانَ لِشُرَكَائِهِمْ فَلَا يَصِلُ إِلَى اللّٰهِ وَمَا كَانَ لِلّٰهِ فَهُوَ يَصِلُ إِلَى شُرَكَائِهِمْ سَاءَ مَا يَحْكُمُونَ
﴿١٣٦﴾ وَكَذٰلِكَ زَيَّنَ لِكَثِيرٍ مِنَ الْمُشْرِكِينَ قَتْلَ أَوْلَادِهِمْ شُرَكَاؤُهُمْ لِيُرْدُوهُمْ وَلِيَلْبِسُوا عَلَيْهِمْ
دِينَهُمْ وَلَوْ شَاءَ اللّٰهُ مَا فَعَلُوهُ فَذَرْهُمْ وَمَا يَفْتَرُونَ ﴿١٣٧﴾ وَقَالُوا هٰذِهِ أَنْعَامٌ وَحَرْثٌ حِجْرٌ

---

bir hissə Allah-Təaladan ötrü və bir hissə də bütlərdən ötrü ayırardılar. Allah-Təaladan ötrü təyin edilən pay əgər artıb yaxşı hasil olsaydı, onu bütlərdən ötrü ayırardılar. Amma əgər bütlərdən ötrü müəyyənləşdirilən pay artıb yaxşı olsaydı, onu Allah-Təaladan ötrü ayırmazdılar. Necə ki buyurur:) **(فَمَا كَانَ لِشُرَكَائِهِمْ فَلَا يَصِلُ إِلَى اللّٰهِ) – onların bütlərindən ötrü olan şeylər Allah-Təalaya yetişməz,** (yəni Allah-Təala yolunda onu sərf etməzlər), **(وَمَا كَانَ لِلّٰهِ فَهُوَ يَصِلُ إِلَى شُرَكَائِهِمْ) – Allah-Təaladan ötrü olan şeylər isə onların bütlərinə yetişər.** (Allah- Təalanın payını bütlərin yolunda sərf edərlər). **(سَاءَ مَا يَحْكُمُونَ) – nə pis hökm edib bütləri Allah-Təalaya üstün tuturlar.**

**137) (وَكَذٰلِكَ زَيَّنَ لِكَثِيرٍ مِنَ الْمُشْرِكِينَ قَتْلَ أَوْلَادِهِمْ شُرَكَاؤُهُمْ) – müşriklərə Allah-Təala ilə bütlərin arasında əkin və heyvanı bölüşdürmək gözəl göstərildiyi kimi, həmçinin müşriklərin çoxuna da öz övladlarını* qətlə yetirməyi bütləri gözəl göstərdi. Və o qəbih əməl onların nəzərində gözəl görsəndi. (لِيُرْدُوهُمْ) – bütlər onlara övladlarını qətlə yetirməyi gözəl göstərdilər ki, onları bu əməlləri səbəbi ilə həlak edib, axirətdə həmişəlik əzaba düçar olsunlar. (وَلِيَلْبِسُوا عَلَيْهِمْ دِينَهُمْ) – yenə bu əməl səbəbi ilə Hz. İbrahimin dininə qarışıqlıq salıb, bidətlər yaratsınlar,** (Necə ki Hz. İbrahimin dinini tamamilə tərk edib, müşrik oldular). **(وَلَوْ شَاءَ اللّٰهُ مَا فَعَلُوهُ) – əgər Allah-Təala istəsəydi, zorla onların şirkinə mane olardı.** (Amma Allah-Təala insanı azad yaratdığı üçün buna mane olmadı). **(فَذَرْهُمْ وَمَا يَفْتَرُونَ)** – (ey Məhəmməd)**, müşrikləri Allah-Təalaya etdikləri iftiralar ilə tərk edib onlardan üz döndər. Allah-Təala özü onlardan intiqam alar.**

*(***Qeyd:** Bütpərəstlik qəlbin sərtləşməsinə səbəb olub bəziləri öz övladlarını, xüsusən, qızlarını diri-diri qəbrə qoyub qətlə yetirərdilər. Bəziləri nəzir edirdilər ki, əgər mənim filan qədər oğlum olsa, onun birini qurban edərəm. Necə ki Əbdülmüttəlib belə nəzir etdi ki, əgər 12 oğlum olsa, birini qurban kəsərəm. 12 oğlu oldu. İstədi nəzirinə əməl etsin. Qurbanlıqdan ötrü 12 oğluna püşk atdı, püşk peyğəmbərin atası Abdullaha düşdü. İstədi Abdullahı qurban etsin. Mane oldular, çünki oğlanlarının ən yaxşısı və gözəli Abdullah idi. Getdilər Mədinəyə, kahindən bunu soruşdular. Dedi: "Abdullahın əvəzinə dəvə qoyub, püşk atın. Əgər püşk yenə Abdullaha düşsə, dəvəyə düşənə qədər dəvəni artırın". Gəlib, dəvə üçün püşk atdılar, yüz dəvəyə qədər püşk Abdullaha düşdü. Elə ki, dəvənin sayı 100-ə çatdı, püşk dəvələrə düşdü. Abdullah xilas olub, dəvələri qurban etdilər).*

**138) (وَقَالُوا هٰذِهِ أَنْعَامٌ وَحَرْثٌ حِجْرٌ) – müşriklər dedilər: "Bu heyvanlar və əkin ki, Allah-Təaladan ötrü pay veririk, onları yemək xalqa qadağandır.**

لَا يَطْعَمُهَا إِلَّا مَنْ نَشَاءُ بِزَعْمِهِمْ وَأَنْعَامٌ حُرِّمَتْ ظُهُورُهَا وَأَنْعَامٌ لَا يَذْكُرُونَ اسْمَ اللَّهِ عَلَيْهَا افْتِرَاءً عَلَيْهِ سَيَجْزِيهِمْ بِمَا كَانُوا يَفْتَرُونَ ﴿١٣٨﴾ وَقَالُوا مَا فِي بُطُونِ هَذِهِ الْأَنْعَامِ خَالِصَةٌ لِذُكُورِنَا وَمُحَرَّمٌ عَلَى أَزْوَاجِنَا وَإِنْ يَكُنْ مَيْتَةً فَهُمْ فِيهِ شُرَكَاءُ سَيَجْزِيهِمْ وَصْفَهُمْ إِنَّهُ حَكِيمٌ عَلِيمٌ ﴿١٣٩﴾ قَدْ خَسِرَ الَّذِينَ قَتَلُوا أَوْلَادَهُمْ سَفَهًا بِغَيْرِ عِلْمٍ

---

**Heç kim onlardan yeyə bilməz. (لَا يَطْعَمُهَا إِلَّا مَنْ نَشَاءُ بِزَعْمِهِمْ) – bizim yeməsini istəmədiyimiz şəxsdən başqası onu yeyə bilməz.** (O paydan kişilərə və bütlərin xidmətçilərinə verərdilər. Qadınlara, uşaqlara verməzdilər. Bu sözü öz etiqadları ilə dedilər. Allah-Təala onları əmr etməyibdir ki, bəzisinə verib, bəzilərinə verməsinlər)”. **(وَأَنْعَامٌ حُرِّمَتْ ظُهُورُهَا) – yenə müşriklər dedilər: “Bunlar o heyvanlardır ki, onları işlətmək və minmək haramdır, (o heyvanlar - bəhirə, saibə, vəsilə və hamdır, Maidə surəsinin 108-ci ayəsində onların mənası qeyd olundu). (وَأَنْعَامٌ لَا يَذْكُرُونَ اسْمَ اللَّهِ عَلَيْهَا) – və yenə o heyvanlar ki,** (onları kəsərkən) **Allah-Təalanın adını zikr etmirdilər, müşriklər dedilər: “Bu heyvanları yemək halaldır”. (افْتِرَاءً عَلَيْهِ) – Allah-Təalaya iftira edib, yalandan bu sözləri Allah-Təalaya isnad edib deyirdilər: “Bu hökmləri Allah-Təala əmr edibdir”. (سَيَجْزِيهِمْ بِمَا كَانُوا يَفْتَرُونَ) – əlbəttə, Allah-Təalaya iftira edib yalan şəhadət etdiklərinə görə, Allah-Təala onlara öz əməllərinin cəzasını verib əzab edəcəkdir.**

**139) (وَقَالُوا مَا فِي بُطُونِ هَذِهِ الْأَنْعَامِ) – müşriklər dedilər: “Bu azad olan heyvanların (bəhirə, saibə, vəsilə və ham) qarnında olan balaları (خَالِصَةٌ لِذُكُورِنَا) – əgər diri doğulsalar, bizim kişilərimizə məxsusdur, onları ancaq kişilər yeyər. (وَمُحَرَّمٌ عَلَى أَزْوَاجِنَا) – onları yemək bizim qadınlarımıza haramdır. (وَإِنْ يَكُنْ مَيْتَةً) – əgər ölü doğulsalar, (فَهُمْ فِيهِ شُرَكَاءُ) – kişi və qadınların hamısı onu yeməkdə şərikdirlər”. (سَيَجْزِيهِمْ وَصْفَهُمْ) – bu haram, halala Allah-Təala hökm verməyib, yalandan Allah-Təalaya isnad edirlər. Əlbəttə, Allah-Təala onlara yalandan dedikləri sözlərinin cəzasını verib əzab edəcəkdir. (إِنَّهُ حَكِيمٌ عَلِيمٌ) – həqiqətən, Allah-Təala hikmət sahibidir, xalqın yalan və doğru sözlərinə agahdır.**

**140) (قَدْ خَسِرَ الَّذِينَ قَتَلُوا أَوْلَادَهُمْ سَفَهًا بِغَيْرِ عِلْمٍ) – həqiqətən, o şəxslər ki cahillikləri səbəbi ilə övladlarını qətlə yetirib,* özlərinə zərər verdilər.** (Ərəb əyanları qız övladlarını qətlə yetirərdilər, Allah-Təala bu ayədə onları məzəmmət edib əməllərinin çirkin olduğunu bəyan edir).

*(***Qeyd:** İlahi, cəhalət nə pis xüsusiyyətdir ki, insan o səbəbdən özünün can-ciyəri olan övladını qətlə yetirir, həqiqətən, insan cəhalət səbəbi ilə ən murdar heyvandan da əskik olar. Amma elm səbəbinə ali mərtəbələrə və məqamlara yetişər, insanlığın ən uca mərtəbəsi olan peyğəmbərlik elm səbəbinə şərəfli deyilmi? (O səbəbdən islam şəriətinin sahibi elm və mədəniyyəti təşviq edib buyurubdur: “Beşikdən qəbrə qədər*

*elm tələb edin". İslam dininin əsası elmlə möhkəm və bərqərar olubdur. Amma çox əfsus ki, müsəlmanların cahillikləri səbəbi ilə etdikləri əməllər, islamın bünövrəsinə vurduqları zərərlər o dərəcəyə çatıb ki, cahiliyyə çağından betər əməllər bizdən meydana gəlir. Ərəblərin əyanları öz qızlarını qətlə yetirərdilər ki, birdən onları xəcalətli edərlər, ya da yoxsul olub onların ruzisini verə bilməzlər. Ərəblərin arasında bu bidəti ilk edən bəni-Minqər camaatından Qeys ibn Asim idi. Həmin camaatın böyüyü və ağasıydı. Ondan sonra ərəblərin digər əyanları da ona tabe olub, qızlarını qətlə yetirirdilər (Buxari, Ədəb 18). İslam dini zühur edib bu çirkin bidəti məhv etdi. Həmin Qeys Hz. Peyğəmbərin hüzuruna gəlib islamla şərəfləndi. Hz. Peyğəmbər ondan soruşdu: "Bəs qızları qətlə yetirəndə heç qəlbin ağrımadı?" Ərz etdi ki, ey Peyğəmbər, bir dəfə mən səfərə getdim, xanımım hamilə idi. Səfərdən gəlib soruşdum ki, uşaq necə oldu? Xanım dedi ki, doğarkən öldü. Mən də inandım. Neçə ildən sonra bir gün evə gələndə balaca bir gözəl qız gördüm. Soruşdum ki, bu qız kimindir? Xanım dedi ki, sənindir. Mən təəccüb etdim. Xanım ağlayıb dedi: "Bu həmin qızdır ki, sənə doğarkən öldüyünü demişdim", onu dayılarına vermişdim. Dayıları onu yetişdirdi. Mən onu sevmiş kimi davranıb, fürsət gözlədim. Bir gün xanım uşağı unudub, evdən harasa getdi, halbuki heç vaxt uşağı unutmazdı. Mən uşağı götürüb səhraya apardım. Səhrada bir quyu qazıb uşağı o quyuya saldım. Üstünə torpaq tökməyə başladım. Elə ki uşaq gördü, onun üstünə torpaq tökürəm, məni qucaqlayıb dedi: "Ata, bəs məni torpaq altında qoyub öldürəcəksən? Məni anamın yanına apar". Uşaq torpağın altında qalıb ölənə qədər onun sözlərinə qulaq asdım. Axırda qız orada həlak oldu. Bu qıza görə qəlbim bir qədər ağrıdı. Hz. Peyğəmbərin gözlərindən yaş axıb buyurdu: "Mərhəmətsiz şəxsə Allah-Təala da rəhm etməz". Bu xəbis adət ərəblərin arasında yayılmışdı. Şair Fərəzdağın babası Səsaə ərəb qəbilələrini gəzər, qızları atalarından pulla, ya da bir neçə dəvəyə qarşılıq alıb ölməkdən xilas edərdi. Fərəzdaq babasının bu əməli ilə fəxr edib qəsidələrində bu mətləbə işarə edir. Bir qəsidəsində deyir:*

> *"Dədəm qız uşaqlarını öldürməkdən qurtardı,*
> *Öləcək qızı diritdi də öləcəkkən ölümdən qurtardı".*

*Səsaənin bu gözəl əməlinin səbəbi bu idi: bir gün bir qəbilədən keçirdi. Gördü bir kişi yer qazır. Amma xanımı ağlayır. Səsaə qadına dedi: niyə ağlayırsan? Qadın dedi: "Bir qızımız var, bu kişi onun atasıdır, istəyir onu bu qazılan yerə salıb həlak etsin. Səsaə o kişiyə dedi: niyə bu qızı qətlə yetirirsən?" Dedi: "Yoxsulluqdan və aclıqdan qorxuram". Səsaə dedi: "Mən bu qızı yanında iki balası olan iki dəvə ilə səndən alıram, onların südüylə dolanıb, bu qızı qətlə yetirmə". Kişi dedi: "Qəbul etdim". Yanında balaları olan iki dəvəni, bir də öz mindiyi nər dəvəni ona verib o qızı ölməkdən xilas etdi. Ondan sonra Səsaə öz-özünə düşünüb dedi: "Bu elə bir şərəfli əməldir ki, məndən qabaq ərəblərdən heç kim bu şərəfə nail olmayıbdır". Özünə söz verdi ki, harda bir qızın öldürülmək istəndiyini eşitsə, onu xilas etsin. İslamın zühuruna qədər 400 nəfər qızı satın alıb, ölümdən xilas etdi. Özü də Hz. Peyğəmbərin hüzuruna gəlib islamla şərəfləndi. Belə kişilərin adının tarixə həkk olunması lazımdır).*

**وَحَرَّمُوا مَا رَزَقَهُمُ اللَّهُ افْتِرَاءً عَلَى اللَّهِ قَدْ ضَلُّوا وَمَا كَانُوا مُهْتَدِينَ ﴿١٤٠﴾ وَهُوَ الَّذِي أَنْشَأَ جَنَّاتٍ مَعْرُوشَاتٍ وَغَيْرَ مَعْرُوشَاتٍ وَالنَّخْلَ وَالزَّرْعَ مُخْتَلِفًا أُكُلُهُ وَالزَّيْتُونَ وَالرُّمَّانَ مُتَشَابِهًا وَغَيْرَ مُتَشَابِهٍ كُلُوا مِنْ ثَمَرِهِ إِذَا أَثْمَرَ وَآتُوا حَقَّهُ يَوْمَ حَصَادِهِ وَلَا تُسْرِفُوا إِنَّهُ لَا يُحِبُّ الْمُسْرِفِينَ ﴿١٤١﴾ وَمِنَ الْأَنْعَامِ حَمُولَةً وَفَرْشًا كُلُوا مِمَّا رَزَقَكُمُ اللَّهُ**

---

**(وَحَرَّمُوا مَا رَزَقَهُمُ اللَّهُ) – müşriklər Allah-Təalanın halal etdiyi ruziləri** (əvvəldə qeyd olunan heyvanları) **özlərinə haram etdilər. (افْتِرَاءً عَلَى اللَّهِ) – Allah-Təalaya iftira edib deyirlər: "Bunları Allah-Təala bizə haram edibdir". (قَدْ ضَلُّوا وَمَا كَانُوا مُهْتَدِينَ) – həqiqətən, müşriklər zəlalətə düşüb,** (Quran) **səbəbinə hidayət tapıb islama daxil olmadılar.**

**141) (وَهُوَ الَّذِي أَنْشَأَ جَنَّاتٍ مَعْرُوشَاتٍ)** – (bu ayədə Allah-Təala öz nemətlərini qeyd edib buyurur:) **Allah-Təala sizdən ötrü üzüm bağları yaratdı, bəzisini yuxarıda dirək və sütun üstündə, bəzisini yer üstündə hasil edərlər. (Hər bölgənin temperaturu müxtəlif olduğuna görə, bəzi yerlərdə yuxarıda, dirək üstündə, bəzi yerlərdə yer üstündə üzüm bitər. (وَغَيْرَ مَعْرُوشَاتٍ وَالنَّخْلَ وَالزَّرْعَ مُخْتَلِفًا أُكُلُهُ) – yenə Allah-Təala sizdən ötrü xurma ağacını, başqa dənli bitkiləri** (buğda, arpa, noxud, mərci və bunlardan başqa əkilən şeyləri yaratdı), **onların dadı da müxtəlifdir. Xurma hərçənd eyni cins meyvədir, amma bəzisinin rəngi və dadı müxtəlif olur, habelə əkilən şeylər də bir-birindən fərqli olar. (وَالزَّيْتُونَ وَالرُّمَّانَ) – və yenə Allah-Təala sizdən ötrü zeytun və narı yaratdı. (مُتَشَابِهًا وَغَيْرَ مُتَشَابِهٍ) – narın bəzisinin rəngi və dadı bir-birinə bənzər olar, bəzisinin ki, oxşar olmaz. (كُلُوا مِنْ ثَمَرِهِ إِذَا أَثْمَرَ) – bu qeyd olunanlar nə zaman meyvə versələr, onların meyvəsindən yeyin, sizə halaldır. (وَآتُوا حَقَّهُ يَوْمَ حَصَادِهِ) – bu qeyd olunan meyvələri dərib biçən günü zəkatını verin. (xurma, üzüm, arpa, buğda, noxud, mərci, lobya və bunlardan başqa meyvələr və dənli bitkilər biçilən, dərilən günü, gərək, onda bir hissəsi zəkat verilsin. Hərçənd bizim aramızda zəkatın 4 şeydən – xurma, üzüm, arpa, buğdadan verilməsinin vacib olduğu bilinir** (Tusi, Təhzibu, IV/13)**, amma bu ayə bütün meyvə və dənli bitkilərin zəkatının vacib olduğuna açıq-aşkar işarə edir). (وَلَا تُسْرِفُوا) – zəkat verməkdə israf etməyin, elə olmasın ki, hasil olanın hamısını verib, özünüz məhrum qalasınız, ancaq üşr - onda biri kifayət edər. (إِنَّهُ لَا يُحِبُّ الْمُسْرِفِينَ) – həqiqətən, Allah-Təala israf edənləri sevməz.**

**142) (وَمِنَ الْأَنْعَامِ حَمُولَةً وَفَرْشًا)** – (ey insan)**, Allah-Təala sizdən ötrü dörd ayaqlı heyvanlardan həm yük daşıyan, həm də kəsilib yeyilən heyvanları yaradıbdır,** (o heyvanların bəzisi - at, qatır və ulaq kimi yük daşımaq və minilmək, bəzisi də qoyun, keçi kimi yeməkdən ötrü, bəzisi də dəvə və öküz kimi həm yük daşımaq, həm də yeməkdən ötrüdür). **(كُلُوا مِمَّا رَزَقَكُمُ اللَّهُ) – o**

وَلَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِ إِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ ﴿١٤٢﴾ ثَمَانِيَةَ أَزْوَاجٍ مِنَ الضَّأْنِ اثْنَيْنِ وَمِنَ الْمَعْزِ
اثْنَيْنِ قُلْ آلذَّكَرَيْنِ حَرَّمَ أَمِ الْأُنْثَيَيْنِ أَمَّا اشْتَمَلَتْ عَلَيْهِ أَرْحَامُ الْأُنْثَيَيْنِ نَبِّئُونِي بِعِلْمٍ إِنْ كُنْتُمْ صَادِقِينَ
﴿١٤٣﴾ وَمِنَ الْإِبِلِ اثْنَيْنِ وَمِنَ الْبَقَرِ اثْنَيْنِ قُلْ آلذَّكَرَيْنِ حَرَّمَ أَمِ الْأُنْثَيَيْنِ أَمَّا اشْتَمَلَتْ عَلَيْهِ أَرْحَامُ
الْأُنْثَيَيْنِ أَمْ كُنْتُمْ شُهَدَاءَ إِذْ وَصَّاكُمُ اللَّهُ بِهَٰذَا فَمَنْ أَظْلَمُ مِمَّنِ افْتَرَىٰ عَلَى اللَّهِ كَذِبًا لِيُضِلَّ النَّاسَ بِغَيْرِ عِلْمٍ

---

**heyvanları ki, Allah-Təala sizə yeməkdən ötrü ruzi verib, yeyin. (وَلَا تَتَّبِعُوا خُطُوَاتِ الشَّيْطَانِ) – haram, halalda şeytanın vəsvəsəsinə tabe olmayıb, Allah-Təalanın hökmünə itaət edin. ((إِنَّهُ لَكُمْ عَدُوٌّ مُبِينٌ) – həqiqətən, şeytan sizin aşkar olan düşməninizdir.**

**143) (ثَمَانِيَةَ أَزْوَاجٍ) – Allah-Təala sizin üçün 8 cüt yeməli heyvan yaradıbdır. (مِنَ الضَّأْنِ اثْنَيْنِ) – qoyundan iki cüt, biri erkək, biri dişi, (hər cinsin erkəyinə və dişisinə bir yerdə cüt deyilir. Məsələn, kişiyə ər, qadına arvad, bir yerdə cüt deyilir. Bu ölçüyə görə qoyun da cütdür. (وَمِنَ الْمَعْزِ اثْنَيْنِ) – keçini də cüt – erkək, dişi olaraq sizdən ötrü yaradıbdır. (قُلْ آلذَّكَرَيْنِ حَرَّمَ أَمِ الْأُنْثَيَيْنِ)** – (ey Məhəmməd), **müşriklərə de ki, bəs Allah-Təala qoyun və keçinin erkəklərini sizə haram edib, yoxsa dişilərini? Allah-Təala heç birini haram etməyibdir. Özünüzdən haram etməyin. (أَمَّا اشْتَمَلَتْ عَلَيْهِ أَرْحَامُ الْأُنْثَيَيْنِ) – yoxsa Allah-Təala dişi qoyunun və keçinin qarnında olan balaları haram edibdir? (نَبِّئُونِي بِعِلْمٍ إِنْ كُنْتُمْ صَادِقِينَ) – bu halal və haramı Allah-Təalaya isnad etməkdə əgər doğrusunuzsa, bir dəlil üzrə mənə xəbər verin ki, mənə də məlum olsun. Əksinə, siz nəfsani arzularınıza tabe olub öz haram etdiyiniz şeyləri Allah-Təalaya isnad edirsiniz.** (Müşriklər bu qeyd olunan heyvanların bəzən erkəklərini, bəzən dişilərini, bəzən də balalarını özlərinə haram edib, bunu Allah-Təalaya isnad edərdilər).

**144) (وَمِنَ الْإِبِلِ اثْنَيْنِ) – Allah-Təala dəvəni də cüt - bir erkək və bir dişi olaraq sizdən ötrü yaradıbdır. (وَمِنَ الْبَقَرِ اثْنَيْنِ) – inəyi də cüt - bir erkək, bir dişi** (yaradıb), **(قُلْ آلذَّكَرَيْنِ حَرَّمَ أَمِ الْأُنْثَيَيْنِ)** – (ey Məhəmməd), **müşriklərə de ki, bəs Allah-Təala dəvənin, inəyin erkəklərini sizə haram edibdir, yoxsa dişilərini? (أَمَّا اشْتَمَلَتْ عَلَيْهِ أَرْحَامُ الْأُنْثَيَيْنِ) – dişi dəvənin və inəyin qarnında olan balalarını sizə haram edibdir? Bunların heç birini Allah-Təala sizə haram etməyibdir. Bəs nə səbəbə özünüz haram edib Allah-Təalaya isnad edirsiniz? (أَمْ كُنْتُمْ شُهَدَاءَ إِذْ وَصَّاكُمُ اللَّهُ بِهَٰذَا) – yoxsa Allah-Təala bu heyvanların haram olduğunu sizə tövsiyə edəndə siz müşriklər onun yanında idiniz? Bu yalanları Allah-Təalaya isnad etməyin.* (فَمَنْ أَظْلَمُ مِمَّنِ افْتَرَىٰ عَلَى اللَّهِ كَذِبًا) – Allah-Təalaya iftira edib yalan isnad edən şəxsdən daha zalım olan kimdir? (لِيُضِلَّ النَّاسَ بِغَيْرِ عِلْمٍ) – ta ki elmsiz, cəhalət üzrə xalqı zəlalətə salıb,**

**إِنَّ اللَّهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ ﴿١٤٤﴾ قُلْ لَا أَجِدُ فِي مَا أُوحِيَ إِلَيَّ مُحَرَّمًا عَلَى طَاعِمٍ يَطْعَمُهُ إِلَّا أَنْ يَكُونَ مَيْتَةً أَوْ دَمًا مَسْفُوحًا أَوْ لَحْمَ خِنْزِيرٍ فَإِنَّهُ رِجْسٌ أَوْ فِسْقًا أُهِلَّ لِغَيْرِ اللَّهِ بِهِ فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ فَإِنَّ رَبَّكَ غَفُورٌ رَحِيمٌ ﴿١٤٥﴾ وَعَلَى الَّذِينَ هَادُوا حَرَّمْنَا كُلَّ ذِي ظُفُرٍ**

---

**sözünün doğruluğuna məlum və aşkar olan bir dəlili olmasın.** (إِنَّ اللَّهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ) **– həqiqətən, Allah-Təala zalım olan qövm və camaatı haqq tərəfinə hidayət etməz.**

*(*****Qeyd:** *Heyvanların bəzisini halal, bəzisini haram edən onları bəhirə, saibə, vəsilə və ham şəklində ilk ayırd edən şəxs ərəblərdən Ömər ibnül-Həyydir. Ey müsəlmanlar, Allah-Təaladan qorxub özünüzü bu ayənin ehtivasına daxil etməyin, Allah-Təalanın haramını halal, halalını haram etməyin. Bəs sələmçilik halaldır ki, müsəlmanların arasında halal kimi qəbul edilib? Yoxsa zalıma kömək etmək halaldır ki, adam öldürən şəxslərə hörmət və kömək edirlər? Bəs şərab satan şəxslərə satış yeri vermək halaldır ki, bunu edirlər? Yoxsa məsciddə yalan danışmaq, iftira demək halaldır ki, müsəlmanların minbərində bu dinə 100 cür hiylə ilə, Allah-Təalaya və Hz. Peyğəmbərə və onun səhabələrinə və imamlara cürbəcür yalanlar isnad edilir? Təəccüblü olan şey bir şəxsin yalan deməsi deyil, çünki o, sözünü yalan sözlərlə bəzəyib yaymaq istəyir. Təəccüblü olan o camaatdır ki, məsciddə toplanıb, özünü alim kimi qələmə verən naməlum şəxsin xurafatına qulaq asıb, onun yalan sözlərini vəhy kimi qəbul edirlər. İlahi, zülm günbəgün artıb elm adı altında müsəlmanların arasında cəhalət yayılır. İlahi, sən özün yetiş fəryadımıza!)*

**145)** (قُلْ لَا أَجِدُ فِي مَا أُوحِيَ إِلَيَّ مُحَرَّمًا عَلَى طَاعِمٍ يَطْعَمُهُ) – (ey Məhəmməd), **müşriklərə de ki, Allah-Təaladan mənə vəhy olunan hökmlərin arasında yemək yeyən şəxslərə haram olan bir yemək tapmıram.** (إِلَّا أَنْ يَكُونَ مَيْتَةً) **– ancaq özü ölən heyvanın ətindən başqa,** (أَوْ دَمًا مَسْفُوحًا) **– ya da heyvan kəsilən vaxt onun başından tökülən qan,** (أَوْ لَحْمَ خِنْزِيرٍ فَإِنَّهُ رِجْسٌ) **– ya da donuz ətindən başqa, həqiqətən, donuz xəbis və nəcis olan bir heyvandır,** (أَوْ فِسْقًا أُهِلَّ لِغَيْرِ اللَّهِ بِهِ) **– ya da o kəsilən heyvanı yemək günahdır ki, kəsilən vaxt Allah-Təaladan başqasının adı zikr olunub,** (Necə ki müşriklər heyvanları bütlərin adına kəsirdilər)**, haram olunanlar bu qeyd olunan şeylərdir. Bunlardan savayı siz müşriklərin özünüzdən haram etdiyiniz şeylər Allah-Təalaya etdiyiniz iftira və yalandır.** (فَمَنِ اضْطُرَّ غَيْرَ بَاغٍ وَلَا عَادٍ) **– kim naəlac qalıb, bu haramları yeməkdən başqa yeməyə bir şey tapmasa, özü kimi naəlac şəxsə zülm etməyib, onun əlindən alıb yeməyərək və həddi aşmadan, onlardan yeyə bilər,** (فَإِنَّ رَبَّكَ غَفُورٌ رَحِيمٌ) – (ey Məhəmməd), **belə vaxtda həqiqətən, sənin rəbbin Allah-Təala bağışlayıb rəhm edib, onları sıxışdırmaz.**

**146)** (وَعَلَى الَّذِينَ هَادُوا حَرَّمْنَا كُلَّ ذِي ظُفُرٍ) – (yerdə gəzən, ya da havada uçan), barmağı və dırnağı olan hər bir heyvanı yəhudilərə haram etdik. (Bu ayəyə

وَمِنَ الْبَقَرِ وَالْغَنَمِ حَرَّمْنَا عَلَيْهِمْ شُحُومَهُمَا إِلَّا مَا حَمَلَتْ ظُهُورُهُمَا أَوِ الْحَوَايَا أَوْ مَا اخْتَلَطَ بِعَظْمٍ
ذَلِكَ جَزَيْنَاهُمْ بِبَغْيِهِمْ وَإِنَّا لَصَادِقُونَ ﴿١٤٦﴾ فَإِنْ كَذَّبُوكَ فَقُلْ رَبُّكُمْ ذُو رَحْمَةٍ وَاسِعَةٍ وَلَا يُرَدُّ بَأْسُهُ
عَنِ الْقَوْمِ الْمُجْرِمِينَ ﴿١٤٧﴾ سَيَقُولُ الَّذِينَ أَشْرَكُوا لَوْ شَاءَ اللَّهُ مَا أَشْرَكْنَا وَلَا آبَاؤُنَا وَلَا حَرَّمْنَا مِنْ
شَيْءٍ كَذَلِكَ كَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ حَتَّى ذَاقُوا بَأْسَنَا قُلْ هَلْ عِنْدَكُمْ مِنْ عِلْمٍ فَتُخْرِجُوهُ لَنَا

---

görə dırnağı olan və uçan, uçmayan bütün heyvanlar, hətta xoruz və toyuq yəhudilərə haram olunubdur. Çünki bunların barmağı, dırnağı vardır, amma yəhudilər bunları halal sayıb, Tövratın hökmünü dəyişdirib, özləri halal ediblər). (وَمِنَ الْبَقَرِ وَالْغَنَمِ حَرَّمْنَا عَلَيْهِمْ شُحُومَهُمَا) – **öküz, qoyun, keçinin piylərini də yəhudilərə haram etdik, (إِلَّا مَا حَمَلَتْ ظُهُورُهُمَا) – ancaq onların belində olan piy istisnadır, (أَوِ الْحَوَايَا) – ya da bağırsaqlarında olan piy, (أَوْ مَا اخْتَلَطَ بِعَظْمٍ) – ya da sümüyə qarışan piy,** (bu 3 orqanda olan piylər onlara halaldır), **(ذَلِكَ جَزَيْنَاهُمْ بِبَغْيِهِمْ) – itaətdən çıxıb, zülm etdiklərinə görə bu qeyd olunan şeyləri yəhudilərə haram edib, cəza verdik. (وَإِنَّا لَصَادِقُونَ) – həqiqətən, biz hər bir vədimizdə** (asilərə əzab, möminlərə savab vədi verməkdə) **doğru deyənik.**

**147) (فَإِنْ كَذَّبُوكَ)** – (ey Məhəmməd), **əgər sənin - zalımlara əzab ediləcək sözünü təkzib edib qəbul etməyib desələr ki, Allah-Təalanın rəhməti genişdir, bizi sıxışdırmaz, (فَقُلْ رَبُّكُمْ ذُو رَحْمَةٍ وَاسِعَةٍ) – onlara de ki, doğrudur, sizin rəbbiniz Allah-Təala geniş rəhmət sahibidir. Amma Allah-Təalanın rəhməti ona itaətkar olub, zalım olmayan şəxslərədir. Allah- Təalanın o geniş rəhməti asi və zalımlara yetişməz. (وَلَا يُرَدُّ بَأْسُهُ عَنِ الْقَوْمِ الْمُجْرِمِينَ) – heç kim Allah-Təalanın əzabını asi və zalım camaatlardan geri çevirə bilməz.** (Allah-Təalanın geniş rəhmətinə aldanmaq olmaz. Çünki rəhmət zülmə zidd olan xüsusiyyətdir. Heç vaxt zalım şəxs rəhmətə nail olmaz. Vay olsun zalımların halına).

**148) (سَيَقُولُ الَّذِينَ أَشْرَكُوا)** – (ey Məhəmməd), **müşrik olan şəxslərə öz dinlərinin batil olması aşkar olub heç bir dəlil tapmadıqlarında, o zaman belə deyərlər: (لَوْ شَاءَ اللَّهُ مَا أَشْرَكْنَا وَلَا آبَاؤُنَا) – "Əgər Allah-Təala istəsə idi, nə biz, nə də bizim ata-babalarımız Allah-Təalaya şərik qoşmazdıq.** (Zorla bizi müvəhhid edib imana daxil edərdi). **(وَلَا حَرَّمْنَا مِنْ شَيْءٍ) – yenə əgər Allah-Təala istəsə idi, heç bir şeyi biz haram etməzdik,** (indi ki Allah-Təala mane olmur, belə məlum olur ki, Allah-Təala bu əməllərə razıdır)". **(كَذَلِكَ كَذَّبَ الَّذِينَ مِنْ قَبْلِهِمْ)** – (ey Məhəmməd), **bu müşriklər Allah-Təalanın kitabını və peyğəmbərini təkzib edən kimi, habelə onlardan əvvəlkilər də Allah-Təalanın kitabını və peyğəmbərini təkzib etdilər. (حَتَّى ذَاقُوا بَأْسَنَا) – onlara əzab nazil etdik, bizim əzabımızı dadıb tamamən həlak oldular. (قُلْ هَلْ عِنْدَكُمْ مِنْ عِلْمٍ)** – (ey Məhəmməd), **bu müşriklərə de ki, Allah-Təalaya şərik qoşub, iftira etdiyiniz sözlərdən ötrü açıq-aşkar dəlilləriniz varmı? (فَتُخْرِجُوهُ لَنَا) – əgər belə**

إِنْ تَتَّبِعُونَ إِلَّا الظَّنَّ وَإِنْ أَنْتُمْ إِلَّا تَخْرُصُونَ ﴿١٤٨﴾ قُلْ فَلِلَّهِ الْحُجَّةُ الْبَالِغَةُ فَلَوْ شَاءَ لَهَدَاكُمْ أَجْمَعِينَ
﴿١٤٩﴾ قُلْ هَلُمَّ شُهَدَاءَكُمُ الَّذِينَ يَشْهَدُونَ أَنَّ اللَّهَ حَرَّمَ هَذَا فَإِنْ شَهِدُوا فَلَا تَشْهَدْ مَعَهُمْ وَلَا تَتَّبِعْ
أَهْوَاءَ الَّذِينَ كَذَّبُوا بِآيَاتِنَا وَالَّذِينَ لَا يُؤْمِنُونَ بِالْآخِرَةِ وَهُمْ بِرَبِّهِمْ يَعْدِلُونَ ﴿١٥٠﴾ قُلْ تَعَالَوْا أَتْلُ
مَا حَرَّمَ رَبُّكُمْ عَلَيْكُمْ أَلَّا تُشْرِكُوا بِهِ شَيْئًا وَبِالْوَالِدَيْنِ إِحْسَانًا وَلَا تَقْتُلُوا أَوْلَادَكُمْ مِنْ إِمْلَاقٍ نَحْنُ
نَرْزُقُكُمْ وَإِيَّاهُمْ وَلَا تَقْرَبُوا الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ وَلَا تَقْتُلُوا النَّفْسَ الَّتِي حَرَّمَ اللَّهُ إِلَّا بِالْحَقِّ

---

**dəlilləriniz varsa, bizə bəyan edin. (**إِنْ تَتَّبِعُونَ إِلَّا الظَّنَّ**) – siz müşriklər güman və zənnə tabe olub elm üzrə hərəkət etmirsiniz. (**وَإِنْ أَنْتُمْ إِلَّا تَخْرُصُونَ**) – ancaq öz yanınızdan təqdir edirsiniz ki, bu güman etdiyiniz haqdır.**

**149) (**قُلْ فَلِلَّهِ الْحُجَّةُ الْبَالِغَةُ**)** – (ey Məhəmməd)**, müşriklərə de ki, sizin sözünüzün haqq olduğuna dəlil və sübutunuz olmadı, dininizin batil olması haqqındakı tam dəlil Allah-Təalanın yanındadır. Allah-Təalanın dəlili qalib olandır. (**فَلَوْ شَاءَ لَهَدَاكُمْ أَجْمَعِينَ**) – əgər Allah-Təala istəsə idi, sizin hamınızı din və islam tərəfinə hidayət edərdi, lakin sizi öz ixtiyarınıza həvalə edibdir. Belə ki hər şəxsin öz əməlinə görə, ona cəza versin.**

**150) (**قُلْ هَلُمَّ شُهَدَاءَكُمُ الَّذِينَ يَشْهَدُونَ أَنَّ اللَّهَ حَرَّمَ هَذَا**)** – (ey Məhəmməd)**, müşriklərə de ki, gəlin şahidlərinizi gətirin, ta ki buna şəhadət etsinlər ki, Allah-Təala sizə haram edən şeyləri haram edibdir.** (Onlardan ötrü belə şahid ola bilməz). **(**فَإِنْ شَهِدُوا**) – əgər şahidləri olub, onlardan ötrü şəhadət etsələr, (**فَلَا تَشْهَدْ مَعَهُمْ**)** – (ey Məhəmməd)**, sən onların şəhadətinə daxil olub şəhadətlərini təsdiq etmə, ər ki, bizim ayə və ehkamlarımızı təkzib edib axirətə iman gətirmir, onların nəfsani arzularına tabe olma. (**وَهُمْ بِرَبِّهِمْ يَعْدِلُونَ**) – çünki onlar öz rəbləri Allah-Təalaya şərik qoşurlar.** (Əlbəttə, belə şəxslərdən kənar olub, onlara tabe olmamaq lazımdır).

**151) (**قُلْ تَعَالَوْا أَتْلُ مَا حَرَّمَ رَبُّكُمْ عَلَيْكُمْ**)** – (ey Məhəmməd)**, müşriklərə de ki, gəlin sizdən ötrü o şeyləri bəyan edim ki, Allah-Təala onu sizə haram edibdir. Sizin haram etdiyiniz şeylər qalsın, baxıb görək Allah-Təalanın haram etdiyi şeylər hansıdır ki, siz onları halal edibsiniz. (**أَلَّا تُشْرِكُوا بِهِ شَيْئًا**) – əvvəlcə, gərək, Allah-Təalaya şərik qoşmayasınız, ilk haram budur. (**وَبِالْوَالِدَيْنِ إِحْسَانًا**) – ikincisi odur ki, valideynə ağ olmayasınız, valideynə yaxşılıq edəsiniz.** (Allah-Təalaya şərik qoşmamaqla valideynə ağ olmağı bir yerdə qeyd etmək onun böyük günah olduğunu göstərir). **(**وَلَا تَقْتُلُوا أَوْلَادَكُمْ مِنْ إِمْلَاقٍ**) – 3-cü haram odur ki, övladlarınızı aclıq qorxusundan qətlə yetirməyin. (**نَحْنُ نَرْزُقُكُمْ وَإِيَّاهُمْ**) – sizə və övladlarınıza ruzi verən bizik. Nədən ötrü övladlarınızı öldürürsünüz? (**وَلَا تَقْرَبُوا الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ**) – 4-cü haram odur ki, aşkar və gizlində günaha yaxınlaşıb, günah etməyin. (**وَلَا تَقْتُلُوا النَّفْسَ الَّتِي حَرَّمَ اللَّهُ إِلَّا بِالْحَقِّ**) – 5-ci haram odur ki, haqlı olanın xaricində, Allah-Təalanın**

ذَلِكُمْ وَصَّاكُمْ بِهِ لَعَلَّكُمْ تَعْقِلُونَ ﴿١٥١﴾ وَلَا تَقْرَبُوا مَالَ الْيَتِيمِ إِلَّا بِالَّتِي هِيَ أَحْسَنُ حَتَّى يَبْلُغَ
أَشُدَّهُ وَأَوْفُوا الْكَيْلَ وَالْمِيزَانَ بِالْقِسْطِ لَا نُكَلِّفُ نَفْسًا إِلَّا وُسْعَهَا وَإِذَا قُلْتُمْ فَاعْدِلُوا وَلَوْ كَانَ ذَا
قُرْبَى وَبِعَهْدِ اللَّهِ أَوْفُوا ذَلِكُمْ وَصَّاكُمْ بِهِ لَعَلَّكُمْ تَذَكَّرُونَ ﴿١٥٢﴾ وَأَنَّ هَذَا صِرَاطِي مُسْتَقِيمًا
فَاتَّبِعُوهُ وَلَا تَتَّبِعُوا السُّبُلَ

---

**öldürməyi haram etdiyi şəxsi qətlə yetirməyin. Ancaq o zaman caizdir, (məsələn, qisas kimi). (ذَلِكُمْ وَصَّاكُمْ بِهِ لَعَلَّكُمْ تَعْقِلُونَ) – bu qeyd olunan hökmlərə əməl etməyi Allah-Təala sizə tövsiyə edib, vacib edibdir ki, fikir verib bu təkliflərdə olan faydaları anlayıb, onlara əməl edəsiniz.**

**152) (وَلَا تَقْرَبُوا مَالَ الْيَتِيمِ إِلَّا بِالَّتِي هِيَ أَحْسَنُ) – 6 -cı haram odur ki, gözəl şəkildə idarə edib, yox olmaqdan saxlamaq istisna olmaqla, yetimin malına yaxınlaşıb, onu idarə etməyin,** (ancaq o vaxt yetimin malını idarə etmək caizdir, hətta onu yox olmaqdan qorumaq vacibdir), **(حَتَّى يَبْلُغَ أَشُدَّهُ) – ki, yetim həddi-büluğa çatana qədər yetimin malını gərək qoruyub saxlayasınız və məhv olmaqdan mühafizə edəsiniz. Elə ki yetkinləşdi, o vaxt onun malını özünə qaytarın.** (Hərçənd bizim aramızda belə adətdir ki, yetim 15 yaşından sonra məsuldur və malının ixtiyarı özündədir. Amma 15 yaşına yetişmək ibadətin şərtidir. Bu ayədə Allah-Təala yaş barəsində bir şey qeyd etməyibdir. Ancaq həddi-büluğa və yetkinliyə çatmağı qeyd edibdir. Ola bilər ki, uşaq 15 yaşında və ya 20 yaşında, ya da daha sonra yetkinləşsin, əsl olan 15 yaşına çatmaq deyil, yetkinləşməkdir). **(وَأَوْفُوا الْكَيْلَ وَالْمِيزَانَ بِالْقِسْطِ) – yeddinci haram odur ki, ticarətdə malı ölçəndə və tərəzidə çəkəndə xəyanət etməyin. Ölçüdə və tərəzidə haqqı ədalət üzrə yerinə yetirin. (لَا نُكَلِّفُ نَفْسًا إِلَّا وُسْعَهَا) – ölçü və tərəzi ilə haqqı yerinə yetirməkdə heç kimə öz gücünün üstündə bir şey yükləmərik,** (çünki ölçüdə və tərəzidə artıq və əskik etməməkdə ədalət üzrə diqqət etmək son dərəcə müşküldür. O səbəbdən buyurur ki, güc və taqətiniz qədər, gərək, diqqət edəsiniz. Ondan sonra cüzi artıq, ya da əskik olması bağışlanıbdır). **(وَإِذَا قُلْتُمْ فَاعْدِلُوا) – 8 -ci haram odur ki, söz danışanda, ya da şəhadət edəndə tərəfgirlik, dost-aşnalıq, qohumbazlıq, millətçilik etməyin. Bir söz deyəndə, ədalət üzrə deyin. (وَلَوْ كَانَ ذَا قُرْبَى) – hətta söz deyilən şəxs sizə yaxın qohum olub, söz onun zərərinə olsa da, gərək, ədalət üzrə deyəsiniz. (وَبِعَهْدِ اللَّهِ أَوْفُوا) – 9 -cu haram odur ki, Allah-Təalaya söz verib, onun vacib etdiyi ibadətləri tərk etməyin. Allah-Təalanın əhdinə vəfa edib, Onun vacib saydığı ibadətlərinə əməl edin. (ذَلِكُمْ وَصَّاكُمْ بِهِ) – bu qeyd olunan hökmlərə əməl etməyi Allah-Təala sizə tövsiyə edib vacib edir ki, (لَعَلَّكُمْ تَذَكَّرُونَ) – bəlkə, siz agah olub öyüd-nəsihəti qəbul edəsiniz.**

**153) (وَأَنَّ هَذَا صِرَاطِي مُسْتَقِيمًا فَاتَّبِعُوهُ) – sizə tövsiyə etdiyim bu sözlər mənim düz olan yolumdur. Gərək, bu yolla gedəsiniz. (وَلَا تَتَّبِعُوا السُّبُلَ) – mənim yo-**

فَتَفَرَّقَ بِكُمْ عَنْ سَبِيلِهِ ذَلِكُمْ وَصَّاكُمْ بِهِ لَعَلَّكُمْ تَتَّقُونَ ﴿١٥٣﴾ ثُمَّ آتَيْنَا مُوسَى الْكِتَابَ تَمَامًا عَلَى
الَّذِي أَحْسَنَ وَتَفْصِيلًا لِكُلِّ شَيْءٍ وَهُدًى وَرَحْمَةً لَعَلَّهُمْ بِلِقَاءِ رَبِّهِمْ يُؤْمِنُونَ ﴿١٥٤﴾ وَهَذَا كِتَابٌ
أَنْزَلْنَاهُ مُبَارَكٌ فَاتَّبِعُوهُ وَاتَّقُوا لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿١٥٥﴾ أَنْ تَقُولُوا إِنَّمَا أُنْزِلَ الْكِتَابُ عَلَى طَائِفَتَيْنِ
مِنْ قَبْلِنَا وَإِنْ كُنَّا عَنْ دِرَاسَتِهِمْ لَغَافِلِينَ ﴿١٥٦﴾ أَوْ تَقُولُوا لَوْ أَنَّا أُنْزِلَ عَلَيْنَا الْكِتَابُ لَكُنَّا أَهْدَى
مِنْهُمْ فَقَدْ جَاءَكُمْ بَيِّنَةٌ مِنْ رَبِّكُمْ وَهُدًى وَرَحْمَةٌ

---

**lumdan kənar, özgə yollara tabe olmayın. (فَتَفَرَّقَ بِكُمْ عَنْ سَبِيلِهِ) – o vaxt da Allah-Təala sizi düz yolundan azdırıb, sizdən ötrü heç vaxt nicat olmaz. (ذَلِكُمْ وَصَّاكُمْ بِهِ) – Allah-Təala öz dininə və yoluna tabe olmağı, özgə yollardan kənar olmağı sizə tövsiyə edir. (لَعَلَّكُمْ تَتَّقُونَ) – əlbəttə, siz gərək müttəqi olub, zəlalət yolundan kənar olub hidayət yoluna tabe olasınız.**

**154) (ثُمَّ آتَيْنَا مُوسَى الْكِتَابَ) – bu qeyd olunan tövsiyələri keçən peyğəmbərlərin ümmətlərinə edəndən sonra Musaya da bu tövsiyələrin qeyd olunduğu Tövratı bəxş etdik. (تَمَامًا عَلَى الَّذِي أَحْسَنَ) – Hz. Musanın ümmətindən yaxşı əməl sahibi olan şəxslərə nemətimizi tamamlamaqdan ötrü, (وَتَفْصِيلًا لِكُلِّ شَيْءٍ) – bir də hər bir dini hökmü təfsilatı ilə bəyan etməkdən ötrü, (وَهُدًى وَرَحْمَةً) – bir də xalqa hidayət olub ilahi rəhməti onlara şamil etməkdən ötrü, bu kimi səbəblərdən Tövratı Musaya bəxş etdik. (لَعَلَّهُمْ بِلِقَاءِ رَبِّهِمْ يُؤْمِنُونَ) – əlbəttə, gərək, Tövratın səbəbinə Musanın ümməti qiyamət günündə Allah-Təalanın savab və əzabı ilə qarşılaşmağa iman etsinlər.**

**155) (وَهَذَا كِتَابٌ أَنْزَلْنَاهُ مُبَارَكٌ) –** (ey insan)**, bu Quran bizim nazil etdiyimiz, xeyir və mənfəətli olan bir kitabdır, (فَاتَّبِعُوهُ وَاتَّقُوا) – əlbəttə, ona tabe olub, Allah-Təaladan qorxub Quranın hökmlərinə müxalif olmayın. (لَعَلَّكُمْ تُرْحَمُونَ) – əlbəttə, Allah-Təala sizə rəhm edib, geniş olan rəhməti sizə şamil olar.**

**156) (أَنْ تَقُولُوا) – Quranı sizə nazil etdik ki, belə deməyəsiniz: (إِنَّمَا أُنْزِلَ الْكِتَابُ عَلَى طَائِفَتَيْنِ مِنْ قَبْلِنَا) – "Bizdən qabaq iki tayfaya** (yəhudi və xristianlara) **kitab nazil olubdur. Bizə ki kitab nazil olmayıbdır, biz niyə iman gətirək? (وَإِنْ كُنَّا عَنْ دِرَاسَتِهِمْ لَغَافِلِينَ) – həqiqətən, yəhudi və xristianların oxuduğu kimi, Tövrat və İncili oxumaqdan qafil idik".**

**157) (أَوْ تَقُولُوا لَوْ أَنَّا أُنْزِلَ عَلَيْنَا الْكِتَابُ) – yenə sizə Quranı nazil etdik ki, deməyəsiniz ki, əgər həqiqətən, bizə kitab nazil olsaydı, (لَكُنَّا أَهْدَى مِنْهُمْ) – əlbəttə, biz yəhudi və xristianlardan artıq hidayət tapan olardıq.** (Çünki bizim fəhm və fərasətimiz, hafizə gücümüz onlardan artıqdır). **(فَقَدْ جَاءَكُمْ بَيِّنَةٌ مِنْ رَبِّكُمْ وَهُدًى وَرَحْمَةٌ) – əgər sizə Allah-Təala tərəfindən kitab gəlməsəydi, bu sözləri deyəcəkdiniz. İndi isə həqiqətən açıq-aşkar olan hidayət dəlili və rəhmət**

فَمَنْ أَظْلَمُ مِمَّنْ كَذَّبَ بِآيَاتِ اللَّهِ وَصَدَفَ عَنْهَا سَنَجْزِي الَّذِينَ يَصْدِفُونَ عَنْ آيَاتِنَا سُوءَ الْعَذَابِ
بِمَا كَانُوا يَصْدِفُونَ ﴿١٥٧﴾ هَلْ يَنْظُرُونَ إِلَّا أَنْ تَأْتِيَهُمُ الْمَلَائِكَةُ أَوْ يَأْتِيَ رَبُّكَ أَوْ يَأْتِيَ بَعْضُ آيَاتِ
رَبِّكَ يَوْمَ يَأْتِي بَعْضُ آيَاتِ رَبِّكَ لَا يَنْفَعُ نَفْسًا إِيمَانُهَا لَمْ تَكُنْ آمَنَتْ مِنْ قَبْلُ أَوْ كَسَبَتْ فِي إِيمَانِهَا
خَيْرًا قُلِ انْتَظِرُوا إِنَّا مُنْتَظِرُونَ ﴿١٥٨﴾ إِنَّ الَّذِينَ فَرَّقُوا دِينَهُمْ وَكَانُوا شِيَعًا

---

(Quran) **Allah-Təala tərəfindən sizə gəldi. Bəs niyə bu Qurani-Şərifdən üz döndərib ona iman gətirmirsiniz? Ya da ancaq sözdə iman gətirib onun ehkamına əməl eləmirsiniz? (فَمَنْ أَظْلَمُ مِمَّنْ كَذَّبَ بِآيَاتِ اللَّهِ) – Quranın haqq və doğru olduğunu biləndən sonra onu təkzib edib qəbul etməyən şəxsdən daha zalım olan kimdir? (وَصَدَفَ عَنْهَا) – və xalqın Qurana iman gətirməsinə mane olan** (kimdir?) **(سَنَجْزِي الَّذِينَ يَصْدِفُونَ عَنْ آيَاتِنَا سُوءَ الْعَذَابِ بِمَا كَانُوا يَصْدِفُونَ) – o şəxslər ki xalqın bizim ayələrimizə iman gətirməsinə mane olur, mane olduqlarına görə onlara ən pis bir əzab ilə cəza verərik.**

**158) (هَلْ يَنْظُرُونَ إِلَّا أَنْ تَأْتِيَهُمُ الْمَلَائِكَةُ)** – (ey Məhəmməd)**, bu müşriklər iman etməkdən ötrü ancaq mələklərin onların ruhunu alması üçün gəlmələrini gözləyirlər? Ancaq o zaman iman gətirmək istəyirlər? O vaxt iman fayda verməz, (أَوْ يَأْتِيَ رَبُّكَ) – ya da iman gətirmək üçün sənin rəbbin Allah-Təalanın əmrinin zahir olub qiyamətin aşkar olmasını gözləyirlər? (أَوْ يَأْتِيَ بَعْضُ آيَاتِ رَبِّكَ) – yoxsa sənin rəbbin Allah-Təalanın qiyamət günündən ötrü təyin etdiyi bəzi əlamətlərin zahir olmasını gözləyirlər?** (Bu üç vaxtın heç birində iman etmək insana mənfəət verməz). **(يَوْمَ يَأْتِي بَعْضُ آيَاتِ رَبِّكَ)** – (ey Məhəmməd)**, sənin rəbbin Allah-Təalanın qiyamət günündən ötrü təyin etdiyi əlamətlərin bəzisinin gəlib zahir olduğu o gündə, (لَا يَنْفَعُ نَفْسًا إِيمَانُهَا لَمْ تَكُنْ آمَنَتْ مِنْ قَبْلُ) – heç kimə o gündən öncə etmədiyi imanı fayda verməz. (أَوْ كَسَبَتْ فِي إِيمَانِهَا خَيْرًا) – ya da daha əvvəlki imanında bir xeyir əməl qazanmamışsa, o əməlsiz iman da ona mənfəət verməz. (قُلِ انْتَظِرُوا إِنَّا مُنْتَظِرُونَ)** – (ey Məhəmməd)**, müşriklərə de ki, siz gözləyin, həqiqətən, biz də gözləyirik ki, görək qiyamət günündə Allah-Təala bizim aramızda necə hökm edəcəkdir?**

**159) (إِنَّ الَّذِينَ فَرَّقُوا دِينَهُمْ) – o şəxslər ki dinlərini* parça-parça ayırıb, (وَكَانُوا شِيَعًا) – neçə firqə oldular,**

*(****Qeyd:** *Necə ki islam ümmətinin bugünkü günündə müsəlmanlar neçə parçaya bölünüblər, Qurani-Şərif kənarda qalıb hər bir qrup bir qanuna və bir rəhbərə yapışıbdır. Həmin ayənin məzmununa görə qiyamət günündə Allah-Təala tərəfindən Hz. Peyğəmbərə belə hökm edilər: "Ey Məhəmməd, bu ümmətin arasından çıx, bunlar sənin verdiyin qanun və ehkamdan kənardırlar. Bunların işi Allah-Təalaya həvalə edilib. Hamısına əzab olunacaqdır. Bunlarda islam dinindən heç bir iz yoxdur". Müsəlmanların özləri insafla baxsınlar ki, bəs bizim əhvalımız belə deyilmi? Hamı-*

لَسْتَ مِنْهُمْ فِي شَيْءٍ إِنَّمَا أَمْرُهُمْ إِلَى اللَّهِ ثُمَّ يُنَبِّئُهُمْ بِمَا كَانُوا يَفْعَلُونَ ﴿١٥٩﴾ مَنْ جَاءَ بِالْحَسَنَةِ فَلَهُ عَشْرُ
أَمْثَالِهَا وَمَنْ جَاءَ بِالسَّيِّئَةِ فَلَا يُجْزَى إِلَّا مِثْلَهَا وَهُمْ لَا يُظْلَمُونَ ﴿١٦٠﴾ قُلْ إِنَّنِي هَدَانِي رَبِّي إِلَى صِرَاطٍ
مُسْتَقِيمٍ دِينًا قِيَمًا مِلَّةَ إِبْرَاهِيمَ حَنِيفًا وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ ﴿١٦١﴾

---

*mız bir Qurana tabe olsaq da, bir-birimizi təkfir edib bir-birimizə lənət etməyirikmi? Bəs belə bir millət nicat taparmı? Biz müsəlmanlara bugünkü fəsad halımızı islah etməkdən başqa heç bir şey lazım deyil. Bu islah da elm və maariflə mümkündür. Müsəlmanların içində cəhalətin kökü möhkəm olduqca onlardan ötrü nicat ümidi mümkün olmaz.*

*Pərişanlıqda bu millət pərişan olduğun bilməz,*
*İşin hələ yaman, yaxşı, nə saman olduğun bilməz.*
*Dürtübdür gözlərini pərdeyi- cəhllə nadanlıq,*
*Bu cəhllə yenə bax gör ki, nadan olduğun bilməz.*
*Desən Quran xilafına əgər bir hökmü na-məşru*
*Sanıb doğru, xilafi-hökmü-Quran olduğun bilməz).*

**hər bir qrup özündən ötrü bir rəhbər və bir imam təyin etdi.** (لَسْتَ مِنْهُمْ فِي شَيْءٍ) – (ey Məhəmməd)**, sən onlardan kənarsan, onların əməli üzrə deyilsən. Onların əməlləri səndən soruşulmayacaq ki, niyə onlar ixtilaf edib, aralarına təfriqə düşdü?** (إِنَّمَا أَمْرُهُمْ إِلَى اللَّهِ) – (ey Məhəmməd)**, həqiqətən, onların işi Allah-Təalaya qalıb, cəzasını O verəcək, səninlə bir əlaqəsi yoxdur.** (ثُمَّ يُنَبِّئُهُمْ بِمَا كَانُوا يَفْعَلُونَ) – **ondan sonra qiyamət günündə Allah-Təala onlara dünyada etdikləri əməllərini xəbər verəcəkdir.**

**160)** (مَنْ جَاءَ بِالْحَسَنَةِ فَلَهُ عَشْرُ أَمْثَالِهَا) – **kim dünyada xeyir bir əməl və savab etsə, ondan ötrü Allah-Təala yanında onun on misli qədər əvəzi vardır.** (Allah-Təalanın xeyir əməl müqabilində verdiyi ən az əvəz birə ondur. Bəzi məqamlarda birə 700 və hesaba gəlməyən qədər əcr, savabı Allah-Təala öz bəndələrinə bəxş edər). (وَمَنْ جَاءَ بِالسَّيِّئَةِ فَلَا يُجْزَى إِلَّا مِثْلَهَا) – **və kim dünyada şər bir əməl və günah etsə, o şəxsə o günahın misli qədər cəza verilər.** (Savaba artıq əvəz vermək Allah-Təalanın bir lütfüdür, amma günaha bir dəfə cəza vermək ədalətdir). (وَهُمْ لَا يُظْلَمُونَ) – **savab və günah edənlərin heç birinə zülm olunmayıb, savab sahibinin savabı azaldılmaz, günahkara günahından çox əzab olunmaz.**

**161)** (قُلْ إِنَّنِي هَدَانِي رَبِّي إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ) – (ey Məhəmməd)**, de ki, həqiqətən, Allah-Təala məni düz olan yola** (haqqa vasil edən yola) **hidayət edibdir.** (دِينًا قِيَمًا) – **o düz olan yol möhkəm olan bir dindir.** (مِلَّةَ إِبْرَاهِيمَ حَنِيفًا) – **o din İbrahimin dini və ümmətidir. Hz. İbrahim bütün batil dinlərdən keçib haqq tərəfinə yönəldi.** (وَمَا كَانَ مِنَ الْمُشْرِكِينَ) – **müşriklərdən deyildi, belə şəxsin din və ümmətinə tabe olmuşam, siz məndən niyə üz döndərirsiniz?**

قُلْ إِنَّ صَلَاتِي وَنُسُكِي وَمَحْيَايَ وَمَمَاتِي لِلَّهِ رَبِّ الْعَالَمِينَ ﴿١٦٢﴾ لَا شَرِيكَ لَهُ وَبِذَلِكَ
أُمِرْتُ وَأَنَا أَوَّلُ الْمُسْلِمِينَ ﴿١٦٣﴾ قُلْ أَغَيْرَ اللَّهِ أَبْغِي رَبًّا وَهُوَ رَبُّ كُلِّ شَيْءٍ وَلَا تَكْسِبُ
كُلُّ نَفْسٍ إِلَّا عَلَيْهَا وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَى ثُمَّ إِلَى رَبِّكُمْ مَرْجِعُكُمْ فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ فِيهِ
تَخْتَلِفُونَ ﴿١٦٤﴾ وَهُوَ الَّذِي جَعَلَكُمْ خَلَائِفَ الْأَرْضِ وَرَفَعَ بَعْضَكُمْ فَوْقَ بَعْضٍ دَرَجَاتٍ
لِيَبْلُوَكُمْ فِي مَا آتَاكُمْ

---

**162) (قُلْ إِنَّ صَلَاتِي وَنُسُكِي)** – (ey Məhəmməd)**, de ki, həqiqətən, mənim namazım və bütün ibadətlərim (وَمَحْيَايَ وَمَمَاتِي) – həyatımdakı hər bir əməlim, iman və saleh əməllə ölməyim, (لِلَّهِ رَبِّ الْعَالَمِينَ) – hamısı aləmlərə tərbiyə verən rəbb Allah-Təala üçündür.**

**163) (لَا شَرِيكَ لَهُ) – Allah-Təalanın heç bir şəriki yoxdur. (وَبِذَلِكَ أُمِرْتُ) – Allah-Təalaya şərik qoşmamaqla əmr olunmuşam.** (Ağlım mənə şərik qoşmamağı əmr edir). **(وَأَنَا أَوَّلُ الْمُسْلِمِينَ) – islamı ilk qəbul edən də mənəm.**

**164) (قُلْ أَغَيْرَ اللَّهِ أَبْغِي رَبًّا)** – (ey Məhəmməd)**, de ki, bəs mən özümdən ötrü Allah-Təaladan başqa rəbb, tərbiyə verən axtarım? (وَهُوَ رَبُّ كُلِّ شَيْءٍ) – və halbuki hər bir şeyin rəbbi, tərbiyə verəni Allah-Təaladır. Mən də onlardan biriyəm. (وَلَا تَكْسِبُ كُلُّ نَفْسٍ إِلَّا عَلَيْهَا) – hər kəs ancaq özünün zərərinə şər əməl qazanar, (وَلَا تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَى) – heç bir günahkar başqa bir günahkarın günahını və əzabını daşımaz. (ثُمَّ إِلَى رَبِّكُمْ مَرْجِعُكُمْ) – ölüm sizə gələndən sonra rəbbiniz Allah-Təala tərəfinə qayıdacaqsınız. (فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ فِيهِ تَخْتَلِفُونَ) – hər kəsin özündən ötrü seçdiyi din və məzhəbdə ixtilaf etdiyiniz şeyləri Allah-Təala sizə xəbər verib hər şəxsin əməlinin cəzasını özünə verəcəkdir.**

**165) (وَهُوَ الَّذِي جَعَلَكُمْ خَلَائِفَ الْأَرْضِ)** – (ey Qurana və Məhəmmədə iman gətirənlər)**, Allah-Təala sizi yer üzündə özünə varis və xəlifə təyin etdi ki, yer üzünə sahib olub istədiyiniz kimi idarə edəsiniz. (وَرَفَعَ بَعْضَكُمْ فَوْقَ بَعْضٍ دَرَجَاتٍ) – Allah-Təala dünyada olan dərəcələrə görə, (şərəf və səltənətdə, ruzidə) sizlərdən bəzinizi bəzinizdən üstün etdi. (لِيَبْلُوَكُمْ فِي مَا آتَاكُمْ) – ki, Allah-Təala öz verdiyi nemətlər haqqında sizləri imtahan etsin. Görsün ki, o nemətlərə görə Allah-Təalaya şükür, yoxsa nankorluq edirsiniz, qüvvətli zəiflə, yoxsul varlıyla, vəzifə sahibi özünə tabe olanlarla, sultan rəiyyətlə necə rəftar edir?** (İlahi, sən özün agahsan ki, müsəlmanlar sən istəyən kimi hərəkət etmirlər. Onların əvəzinə xəsislik, nifaq, həsəd, zülm, mərdiməzarlıq müsəlmanların arasında rəvac tapıbdır. Qurani-Şərifin gözəl nəsihət və qanunları, Hz. Peyğəmbərin birliyimizə səbəb olan əmrləri tamamən gizlin qalıb, unudulubdur. O səbəbdən müsəlmanlar sənə varis olmağa layiq olmayıb, bu uca mənsəbi, yer üzündə olan ixtiyarlarını onlardan alıb, özgə millətlərə tabe

إِنَّ رَبَّكَ سَرِيعُ الْعِقَابِ وَإِنَّهُ لَغَفُورٌ رَحِيمٌ ﴿١٦٥﴾

---

edibsən)**. (**إِنَّ رَبَّكَ سَرِيعُ الْعِقَابِ**)** – (ey Məhəmməd)**, həqiqətən, sənin rəbbin Allah-Təala öz nemətlərinə nankor olub, razı olmadığı məqamlarda ondan istifadə edənlərə sürətlə əzab edəndir. (**وَإِنَّهُ لَغَفُورٌ رَحِيمٌ**) – və həqiqətən, Allah-Təala öz nemətlərinə şükür edib, hər bir neməti öz yerində istifadə edənlərə rəhm edib bağışlayandır.**

(Allaha həmd olsun, Ənam surəsinin təfsiri bitdi. Hz. Peyğəmbər buyurub: "Kim Ənam surəsini oxuyub, ona əməl etsə, Allah-Təala ona rəhmət göndərər və 70 min mələk Allahdan onu əfv etməsini istəyər).

# əl-ƏRAF SURƏSİ

7-ci surədir. Məkkədə nazil olub, 206 ayə, 3325 kəlmə və 12010 hərfdir.

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ. الٓمٓصٓۜ ﴿١﴾ كِتَابٌ اُنْزِلَ اِلَيْكَ فَلَا يَكُنْ فِي صَدْرِكَ حَرَجٌ مِنْهُ لِتُنْذِرَ بِهٖ
وَذِكْرٰى لِلْمُؤْمِنِينَ ﴿٢﴾ اِتَّبِعُوا مَٓا اُنْزِلَ اِلَيْكُمْ مِنْ رَبِّكُمْ وَلَا تَتَّبِعُوا مِنْ دُونِهٖٓ اَوْلِيَٓاءَۜ قَلِيلًا مَا تَذَكَّرُونَ
﴿٣﴾ وَكَمْ مِنْ قَرْيَةٍ اَهْلَكْنَاهَا فَجَٓاءَهَا بَأْسُنَا بَيَاتًا اَوْ هُمْ قَٓائِلُونَ ﴿٤﴾ فَمَا كَانَ دَعْوٰيهُمْ اِذْ جَٓاءَهُمْ بَأْسُنَٓا

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1) (الٓمٓصٓ ) – bu mübarək surənin adıdır.**

**2) (كِتَابٌ اُنْزِلَ اِلَيْكَ)** – (ey Məhəmməd)**, bu Quran Allah-Təaladan sənə nazil olan bir kitabdır,** (فَلَا يَكُنْ فِي صَدْرِكَ حَرَجٌ مِنْهُ لِتُنْذِرَ بِهٖ) – (ey Məhəmməd)**, bu Quranla xalqı Allah-Təala tərəfinə dəvət edib qorxutmaqdan qəlbin sıxılmasın. Allah-Təala səni xalqın şərindən qoruyur.** (Hz. Peyğəmbər qorxurdu ki, birdən onu qəbul etməzlər, o səbəbdən xalqı dəvət edərkən qəlbi sıxılırdı). **(وَذِكْرٰى لِلْمُؤْمِنِينَ) – möminlərdən ötrü bu Quran bir xatırladıcıdır,** (elə ki Qurani-Şərifin ayələri iman gətirənlərə oxundu, o anda qəbul edib imana gələrlər. Sanki unutduqları şey onların yadına düşər). (Bu xüsusiyyət islama ilk daxil olan möminlərin xüsusiyyətidir)**.**

**3) (اِتَّبِعُوا مَٓا اُنْزِلَ اِلَيْكُمْ مِنْ رَبِّكُمْ )** – (ey insan)**, rəbbiniz Allah-Təaladan sizə nazil olan Qurana tabe olub iman gətirin. (وَلَا تَتَّبِعُوا مِنْ دُونِهٖٓ اَوْلِيَٓاءَ) – Allah-Təaladan başqa, özünüz üçün seçdiyiniz dostlara tabe olmayın. (قَلِيلًا مَا تَذَكَّرُونَ) – öyüd-nəsihəti çox az qəbul edib, Allah-Təalaya az tabe olursunuz.**

**4) (وَكَمْ مِنْ قَرْيَةٍ اَهْلَكْنَاهَا) – nə çox ölkələrin əhalisinə peyğəmbər göndərib, o ölkələrin əhlini peyğəmbərlərə itaət etmədiyi üçün həlak etmişik. (فَجَٓاءَهَا بَأْسُنَا بَيَاتًا اَوْ هُمْ قَٓائِلُونَ) – o ölkələrin əhalisinə gecə yuxuda olanda, ya da zöhrdən sonra istirahət edən vaxtı bizim əzabımız gəlib həlak oldular.** (Bu qeyd olunan iki vaxt istirahət və qəflət vaxtıdır, o vaxtlarda əzabın nazil olması son dərəcə şiddətli və qorxunc olar. O səbəbdən Allah-Təala asilərə o zaman əzab edər. Lut qövmünə gecə vaxtı - sübhdən qabaq, Şüeyb qövmünə zöhrdən sonra əzab nazil oldu).

**5) (فَمَا كَانَ دَعْوٰيهُمْ اِذْ جَٓاءَهُمْ بَأْسُنَٓا) – o zaman ki o ölkələrin əhalisinə bizim əzabımız gəldi, iddia etdikləri din və məzhəbləri onlara fayda verməyib,**

اِلَّا اَنْ قَالُوٓا اِنَّا كُنَّا ظَالِم۪ينَ ﴿٥﴾ فَلَنَسْـَٔلَنَّ الَّذ۪ينَ اُرْسِلَ اِلَيْهِمْ وَلَنَسْـَٔلَنَّ الْمُرْسَل۪ينَۙ ﴿٦﴾ فَلَنَقُصَّنَّ
عَلَيْهِمْ بِعِلْمٍ وَمَا كُنَّا غَٓائِب۪ينَ ﴿٧﴾ وَالْوَزْنُ يَوْمَئِذٍ الْحَقُّۚ فَمَنْ ثَقُلَتْ مَوَاز۪ينُهُ فَاُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ
﴿٨﴾ وَمَنْ خَفَّتْ مَوَاز۪ينُهُ فَاُو۬لٰٓئِكَ الَّذ۪ينَ خَسِرُٓوا اَنْفُسَهُمْ بِمَا كَانُوا بِاٰيَاتِنَا يَظْلِمُونَ﴿٩﴾ وَلَقَدْ
مَكَّنَّاكُمْ فِي الْاَرْضِ وَجَعَلْنَا لَكُمْ ف۪يهَا مَعَايِشَۜ قَل۪يلًا مَا تَشْكُرُونَ۟ ﴿١٠﴾ وَلَقَدْ خَلَقْنَاكُمْ ثُمَّ
صَوَّرْنَاكُمْ ثُمَّ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَۗ

---

**o vaxt onların deyəcək sözü olmadı. (اِلَّا اَنْ قَالُوٓا اِنَّا كُنَّا ظَالِم۪ينَ) – ancaq o din və məzhəblərinin batil olduğunu iqrar edib dedilər: “Həqiqətən, biz Allah-Təalaya itaət etməyib, ona şərik qoşduğumuz üçün zalım olduq”.**

**6) (فَلَنَسْـَٔلَنَّ الَّذ۪ينَ اُرْسِلَ اِلَيْهِمْ) – əlbəttə, qiyamət günündə peyğəmbər göndərilən o ümmətlərdən soruşarıq: “Bəs o vaxt ki peyğəmbərlər sizi dəvət etdilər, onlara nə cavab verdiniz? (وَلَنَسْـَٔلَنَّ الْمُرْسَل۪ينَ) – əlbəttə, peyğəmbərlərdən də soruşarıq: “Bəs ümmətləri dəvət edəndə sizə nə cavab verdilər? Ondan sonra hər bir şəxsə öz əməlinin cəzasını verərik.**

**7) (فَلَنَقُصَّنَّ عَلَيْهِمْ بِعِلْمٍ) – onların zahir və batinlərinə, söz və rəftarlarına agah olduğumuz halda peyğəmbərlərdən və ümmətlərdən ötrü onların sual və cavablarını, hər bir əməllərini zikr edərik. Bilsinlər ki, biz onların hər bir əməllərinə agah olub, (وَمَا كُنَّا غَٓائِب۪ينَ) – onların özlərindən və hər bir əməllərindən qaib** (xəbərsiz) **deyilik.**

**8) (وَالْوَزْنُ يَوْمَئِذٍ الْحَقُّ) – qiyamət günündə hər bir əməlin** (tərəzidə) **çəkilməsi haqq olan hökmlərdəndir. (فَمَنْ ثَقُلَتْ مَوَاز۪ينُهُ) – kimin xeyir əməlinin çəkisi şər əməllərinin çəkisindən ağır olsa, (فَاُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) – əlbəttə, qiyamət günündə nicat tapan şəxslər onlardır.**

**9) (وَمَنْ خَفَّتْ مَوَاز۪ينُهُ) – və kimin xeyir əməllərinin çəkisi şər əməllərinin çəkisindən yüngül olsa, (فَاُو۬لٰٓئِكَ الَّذ۪ينَ خَسِرُٓوا اَنْفُسَهُمْ) – özlərinə zərər verib və əzaba layiq olanlar onlardır. (بِمَا كَانُوا بِاٰيَاتِنَا يَظْلِمُونَ) – bizim ayələrimizə qarşı zalım olub təkzib etdikləri üçün əzaba layiq oldular.**

**10) (وَلَقَدْ مَكَّنَّاكُمْ فِي الْاَرْضِ) – həqiqətən, siz insanları yer üzündə qüdrət və ixtiyar sahibi etdik ki, istədiyiniz kimi idarə edəsiniz. (وَجَعَلْنَا لَكُمْ ف۪يهَا مَعَايِشَ) – sizdən ötrü yer üzündə güzəran və məişət səbəblərini yaratdıq. Ehtiyacınız olan hər şey sizə verilibdir. (قَل۪يلًا مَا تَشْكُرُونَ) – bu nemətlərin müqabilində Allah-Təalaya az şükür edirsiniz.**

**11) (وَلَقَدْ خَلَقْنَاكُمْ) – həqiqətən, sizin babanız Adəmi surətsiz olaraq torpaqdan yaratdıq. (ثُمَّ صَوَّرْنَاكُمْ) – ondan sonra babanız Adəmə insan surəti verdik. (ثُمَّ قُلْنَا لِلْمَلٰٓئِكَةِ اسْجُدُوا لِاٰدَمَ) – ondan sonra** (yer üzündə) **mələklərə**

فَسَجَدُوٓا اِلَّا اِبْلِيسَ ۜ لَمْ يَكُنْ مِنَ السَّاجِدِينَ ﴿١١﴾ قَالَ مَا مَنَعَكَ اَلَّا تَسْجُدَ اِذْ اَمَرْتُكَ ۜ قَالَ اَنَا خَيْرٌ مِنْهُ ۚ خَلَقْتَنِي مِنْ نَارٍ وَخَلَقْتَهُ مِنْ طِينٍ ﴿١٢﴾ قَالَ فَاهْبِطْ مِنْهَا فَمَا يَكُونُ لَكَ اَنْ تَتَكَبَّرَ فِيهَا فَاخْرُجْ اِنَّكَ مِنَ الصَّاغِرِينَ ﴿١٣﴾ قَالَ اَنْظِرْنِيٓ اِلٰى يَوْمِ يُبْعَثُونَ ﴿١٤﴾

---

**əmr etdik: Adəmə səcdə edin. (فَسَجَدُوٓا اِلَّا اِبْلِيسَ) - mələklərin hamısı səcdə etdilər. Ancaq İblis,** (şeytan) **səcdə etmədi. (لَمْ يَكُنْ مِنَ السَّاجِدِينَ) - səcdə edən mələklərdən olmadı.**

**12) (قَالَ) - Allah-Təala buyurdu: "Ey İblis, (مَا مَنَعَكَ اَلَّا تَسْجُدَ اِذْ اَمَرْتُكَ) - sənə əmr etdiyimiz halda Adəmə səcdə etməkdə sənə nə mane oldu?" (قَالَ اَنَا خَيْرٌ مِنْهُ) - İblis** (Allah-Təala cavabında) **dedi: "Mən Adəmdən yaxşıyam, ondan şərəfliyəm. (خَلَقْتَنِي مِنْ نَارٍ) - məni oddan yaradıbsan, (وَخَلَقْتَهُ مِنْ طِينٍ) - Adəmi isə palçıqdan yaradıbsan. Od palçıqdan şərəfli olduğu halda, mən Adəmə necə səcdə edərəm?"**

**13) (قَالَ فَاهْبِطْ مِنْهَا) - Allah-Təala buyurdu: "Ey İblis, itaətkarların məkanı olan o müqəddəs məkandan en.** (Yaxınlıq məqamından çıxıb asilərin məqamına qoşul)**. (فَمَا يَكُونُ لَكَ اَنْ تَتَكَبَّرَ فِيهَا) - o müqəddəs məqamda təkəbbürlənmək sənə caiz deyil,** (özünü təvazökar hesab edəndən sonra təkəbbürlənmək* xətadır)**. (فَاخْرُجْ اِنَّكَ مِنَ الصَّاغِرِينَ) - o məqamdan çıx". Həqiqətən, sən Allah-Təala yanında zəlil və dəyərsiz şəxslərdən oldun. Heç vaxt bundan sonra özünü o müqəddəs məqamda** (itaətkarlar sırasında) **hesab edə bilməzsən.**

*(*****Qeyd:*** *Qurani-Şərifdə İblisin hekayəsinin bir neçə yerdə qeyd edilməsindən məqsəd təkəbbürlü olmağın xəbisliyini bəyan etməkdir. Nə pis, xəbis olan xüsusiyyətdir ki, insanı uca məqamlardan ən alçaq yerlərə düşürər. Allah-Təala insanların dünya həyatında bir-birilərinə qarşı təkəbbürlü olmasına razı deyil və bu səbəbdən Qurani-Şərifdə bu xüsusiyyət dəfələrlə - bəzən İblis hekayəsinin ehtivasında, bəzən açıq-aşkar qadağan edilməklə məzəmmət edilib, bu xəbis olan xüsusiyyətin nəticəsi odur ki, insanlar bir-birilərindən nifrət edib, kənar olarlar. Bir millətin içində o xüsusiyyət yayılsa, təfriqəyə səbəb olub, kin və ədavət yaradar. Amma təvazökarlıq bunun əksinədir. Bu xüsusiyyətdən ittifaq, rəhm, məhəbbət və dostluq meydana gələr. Qurani-Şərifdə insaniyyət xüsusiyyətlərini təşviq edən dəlillərin sayı-hesabı yoxdur. Əgər gecə-gündüz Qurani-Şərifin ayələri təfəkkür edilsə, hər bir ayəsindən necə mənalar çıxar ki, hamısı da insaniyyətə və birliyə işarə edər. Həqiqətən, Qurani-Şərifin şərəfli mətləbləri gizlin qalıb, izhar edənləri isə 100 cür töhmətə düçar edirlər. İlahi, sən özün kömək ol!)*

**14) (قَالَ اَنْظِرْنِيٓ اِلٰى يَوْمِ يُبْعَثُونَ) - İblis dedi: "İlahi, mənə qiyamət gününə qədər möhlət verib, uzun ömür bəxş et".** (Bu sözü İblis cəhalət üzrə dedi, çünki ölməkdən qorxurdu, o səbəbdən uzun ömür istədi. Halbuki nə qədər

قَالَ اِنَّكَ مِنَ الْمُنْظَرِينَ ﴿١٥﴾ قَالَ فَبِمَٓا اَغْوَيْتَنٖي لَاَقْعُدَنَّ لَهُمْ صِرَاطَكَ الْمُسْتَقٖيمَۙ ﴿١٦﴾ ثُمَّ لَاٰتِيَنَّهُمْ
مِنْ بَيْنِ اَيْدٖيهِمْ وَمِنْ خَلْفِهِمْ وَعَنْ اَيْمَانِهِمْ وَعَنْ شَمَٓائِلِهِمْۜ وَلَا تَجِدُ اَكْثَرَهُمْ شَاكِرٖينَ ﴿١٧﴾ قَالَ
اخْرُجْ مِنْهَا مَذْؤُ۫مًا مَدْحُورًاۜ لَمَنْ تَبِعَكَ مِنْهُمْ لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنْكُمْ اَجْمَعٖينَ ﴿١٨﴾ وَيَٓا اٰدَمُ اسْكُنْ
اَنْتَ وَزَوْجُكَ الْجَنَّةَ فَكُلَا مِنْ حَيْثُ شِئْتُمَا

---

uzun ömrü olsa da, yenə axırda öləcəkdir. Gərək, öz xətasını iqrar edib Allah-Təaladan bağışlanmaq istəyəydi, onun əvəzində uzun ömür istədi).

**15) (قَالَ اِنَّكَ مِنَ الْمُنْظَرِينَ) – Allah-Təala buyurdu: "Ey İblis, sənin xahişinə görə sənə möhlət verdik. Qiyamətə kimi sənə ölüm yoxdur".**

**16) (قَالَ فَبِمَٓا اَغْوَيْتَنٖي) – İblis dedi: "Məni asi edib zəlalətə saldığın üçün,** (yəni sən mənə Adəmə səcdə etməyi əmr etməsəydin, mən zəlalətə düşməzdim. Xəbis İblis öz əməlini Allah-Təalaya isnad edir, halbuki öz ixtiyarıyla Adəmə səcdə etməyi rədd etdi. Habelə hər kim öz şər əməlini Allah-Təalaya isnad edir, xəbislikdə şeytana şərikdir). **(لَاَقْعُدَنَّ لَهُمْ صِرَاطَكَ الْمُسْتَقٖيمَ) – mən də o zəlalətin əvəzində xalqın sənə tərəf gələn düz yollarının üstündə əyləşib, onların sənə tərəf gəlməsinə mane olaram.**

**17) (ثُمَّ لَاٰتِيَنَّهُمْ مِنْ بَيْنِ اَيْدٖيهِمْ وَمِنْ خَلْفِهِمْ وَعَنْ اَيْمَانِهِمْ وَعَنْ شَمَٓائِلِهِمْ) – ondan sonra onların qarşılarından və arxalarından, sağ və sol tərəflərindən, dörd tərəfdən gəlib onlara vəsvəsə edib, sənə iman gətirib itaət etmələrinə mane olaram. (وَلَا تَجِدُ اَكْثَرَهُمْ شَاكِرٖينَ) – ilahi, ondan sonra insanların əksəriyyətinin sənə şükür etdiyini görməzsən** (sanki İblisin bu sözü bizim dövrümüzə aiddir. İnsanlar tamamən Allah-Təaladan qafil olub, Ona şükür etməkdən birdəfəlik uzaqlaşıblar. Allah-Təalanın bəxş etdiyi nemətləri öz səy və çalışmalarına isnad edirlər. Allah-Təala zalımların dediyi sözlərdən ucadır).

**18) (قَالَ اخْرُجْ مِنْهَا مَذْؤُ۫مًا مَدْحُورًا) – Allah-Təala buyurdu: "Ey İblis, o müqəddəs məkandan qınanmış, eyiblənmiş və rəhmətimdən kənar olduğun halda çıx. (لَمَنْ تَبِعَكَ مِنْهُمْ) – əlbəttə, insanlardan kim sənə tabe olsa, (لَاَمْلَئَنَّ جَهَنَّمَ مِنْكُمْ اَجْمَعٖينَ) – cəhənnəmi sənin özün və sənə tabe olanlarla tamam dolduraram".** (Ondan sonra Allah-Təala Adəm və Həvvaya xitab edib buyurur:)

**19) (وَيَٓا اٰدَمُ اسْكُنْ اَنْتَ وَزَوْجُكَ الْجَنَّةَ) – "ey Adəm, sən özün və xanımın** (Həvva*) **sizə verdiyim həmin cənnətdə** (bağda) **sakin olun. (فَكُلَا مِنْ حَيْثُ شِئْتُمَا)** – (ey Adəm və Həvva)**, bu bağın istənilən yerində və istənilən meyvələrindən istəsəniz, yeyin.**

*(*Qeyd: Allah-Təala Adəm və Həvvanı Məkkə ilə Taif arasında torpaqdan yaratdı. Bir bağda (ola bilər ki, o bağ Taifdə olmuş olsun) məskun olmalarını əmr etdi.*

وَلَا تَقْرَبَا هٰذِهِ الشَّجَرَةَ فَتَكُونَا مِنَ الظَّالِمِينَ ﴿١٩﴾ فَوَسْوَسَ لَهُمَا الشَّيْطَانُ لِيُبْدِيَ لَهُمَا مَا وُرِيَ
عَنْهُمَا مِنْ سَوْاٰتِهِمَا وَقَالَ مَا نَهٰيكُمَا رَبُّكُمَا عَنْ هٰذِهِ الشَّجَرَةِ اِلَّا اَنْ تَكُونَا مَلَكَيْنِ اَوْ تَكُونَا مِنَ
الْخَالِدِينَ﴿٢٠﴾ وَقَاسَمَهُمَآ اِنّي لَكُمَا لَمِنَ النَّاصِحِينَ ﴿٢١﴾ فَدَلّٰيهُمَا بِغُرُورٍ فَلَمَّا ذَاقَا الشَّجَرَةَ
بَدَتْ لَهُمَا سَوْاٰتُهُمَا وَطَفِقَا يَخْصِفَانِ عَلَيْهِمَا مِنْ وَرَقِ الْجَنَّةِ

---

*Libasları olmadığı üçün biyabanda qalmaq onlar üçün çətin idi. O səbəbdən onlara bir müddət o bağda sakin olmağı əmr etdi).*

**(وَلَا تَقْرَبَا هٰذِهِ الشَّجَرَةَ) – amma bir bu ağaca (məsələn, üzüm ağacı) yaxınlaşmayın. Onun meyvəsindən yeməyin. (فَتَكُونَا مِنَ الظَّالِمِينَ) – əgər o ağacın meyvəsindən yesəniz, o vaxt zalımlardan olarsınız.**

**20) (فَوَسْوَسَ لَهُمَا الشَّيْطَانُ) – şeytan Adəm və Həvvaya o ağacın meyvəsindən yemələri üçün vəsvəsə verdi.** (Adəm və Həvva həmin bağda libassız gəzirdilər. Lüt-üryan olmağın qəbahətini Allah-Təala hələ onlara bildirməmişdi. Şeytanın məqsədi də bu idi ki, o ağacın meyvəsindən yeməklə Adəm və Həvva həm Allah-Təalaya asi olsunlar, həm də lüt-üryan olmağın qəbahəti onlara bəlli olsun. Həm də o vaxt onlardan ötrü yaşamaq çətin olub, daha çox əziyyət çəksinlər. Necə ki Allah-Təala xəbər verir). (لِيُبْدِيَ لَهُمَا مَا وُرِيَ عَنْهُمَا مِنْ سَوْاٰتِهِمَا) – **şeytan onların gizlin qalan eyib yerlərini onlardan ötrü zahir və aşkar etmək üçün o ağacın meyvəsindən yemə xüsusunda onlara vəsvəsə verdi.** (və qalə ma ləha kuma rabbukuma an həzihiş-şəcərə) (وَقَالَ مَا نَهٰيكُمَا رَبُّكُمَا عَنْ هٰذِهِ الشَّجَرَةِ) – **İblis belə vəsvəsə verib Adəm və Həvvaya dedi: "Sizin rəbbiniz Allah-Təala sizə bu ağacın meyvəsini yeməyi ona görə qadağan edibdir ki, (اِلَّا اَنْ تَكُونَا مَلَكَيْنِ) – mələklərdən olmanızı istəmir. (اَوْ تَكُونَا مِنَ الْخَالِدِينَ) – ya da** (istəmir ki,) **heç vaxt ölməyib əbədi qalanlardan olasınız.** (Bu ağacın meyvəsindən kim yesə, ya mələk olar, ya da əbədi olar, heç vaxt ölməz, Allah-Təalanın sizə bu ağacın meyvəsini yeməyi qadağan etməkdə məqsədi odur ki, mələk olmayasınız, ya da əbədi olmayasınız. İblis and içdiyi üçün Adəm və Həvva bu sözlərə aldandılar).

**21) (وَقَاسَمَهُمَآ اِنّي لَكُمَا لَمِنَ النَّاصِحِينَ) – İblis onlardan ötrü and içib dedi: "Əlbəttə, həqiqətən, mən sizə nəsihət verənlərdənəm". Onlar da İblisin andını qəbul edib o meyvədən yemək istədilər.**

**22) (فَدَلّٰيهُمَا بِغُرُورٍ) – o and səbəbinə aldandılar, İblis Adəm və Həvvanı o meyvədən yeməyə sövq edib, o meyvədən yedilər. (فَلَمَّا ذَاقَا الشَّجَرَةَ) – elə o ağacın meyvəsindən yedilər, o meyvənin dadı onlara məlum oldu. (Allah-Təalaya asi olduqlarını bildilər. Günahın və pis şeylərin qəbahəti onlara məlum oldu). (بَدَتْ لَهُمَا سَوْاٰتُهُمَا) – onlardan ötrü eyib yerlərinin qəbahəti məlum olub, (وَطَفِقَا يَخْصِفَانِ عَلَيْهِمَا مِنْ وَرَقِ الْجَنَّةِ) – o bağın ağaclarının yarpaq-**

وَنَادٰيهُمَا رَبُّهُمَٓا اَلَمْ اَنْهَكُمَا عَنْ تِلْكُمَا الشَّجَرَةِ وَاَقُلْ لَكُمَٓا اِنَّ الشَّيْطَانَ لَكُمَا عَدُوٌّ مُبِينٌ ﴿٢٢﴾ قَالَا رَبَّنَا ظَلَمْنَٓا اَنْفُسَنَا وَاِنْ لَمْ تَغْفِرْ لَنَا وَتَرْحَمْنَا لَنَكُونَنَّ مِنَ الْخَاسِرِينَ ﴿٢٣﴾ قَالَ اهْبِطُوا بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّۚ وَلَكُمْ فِي الْاَرْضِ مُسْتَقَرٌّ وَمَتَاعٌ اِلٰى حِينٍ﴿٢٤﴾ قَالَ فِيهَا تَحْيَوْنَ

---

**larından öz eyib yerlərini örtməyə başladılar. (**Bu ayələr eyib yerlərini örtməyin vacib olduğuna dəlildir, eyib yerlərini açıb göstərmək qəbih olan əməllərdəndir). (وَنَادٰيهُمَا رَبُّهُمَٓا اَلَمْ اَنْهَكُمَا عَنْ تِلْكُمَا الشَّجَرَةِ) **- Allah-Təala Adəm və Həvvaya müraciət edib buyurdu: "Bəs mən sizə bu ağacın meyvəsini yeməyi qadağan etmədim, niyə itaətdən çıxıb, o meyvədən yediniz?** (وَاَقُلْ لَكُمَٓا اِنَّ الشَّيْطَانَ لَكُمَا عَدُوٌّ مُبِينٌ) **– bəs sizə demədim ki, həqiqətən, şeytan sizə aşkar olan düşməndir?** (Onun düşmən olduğunu sizə bildirəndən sonra ona itaət etdiniz. Allah-Təala Adəm və Həvvaya bu xitabı edəndən sonra gördülər ki, böyük xəta ediblər. Üzr istəyib xətalarından tövbə etməyə başladılar).

**23) (**قَالَا رَبَّنَا ظَلَمْنَٓا اَنْفُسَنَا**) – dedilər: "Ey bizim rəbbimiz, bu əməldə biz xəta edib, özümüzə zülm* edib sənin qəzəbinə bais olduq". (**وَاِنْ لَمْ تَغْفِرْ لَنَا وَتَرْحَمْنَا**) – əgər rəhm etməyib, bağışlamayıb bizim günahımızdan keçməsən, (**لَنَكُونَنَّ مِنَ الْخَاسِرِينَ**) – əlbəttə, özümüzə zərər verən şəxslərdən olarıq.**

*(****Qeyd:*** *Adəm və Həvvanın təqsiri hərçənd kiçik və bağışlanan günah idi, amma Allah-Təalanın əzəmətinə görə, onu çox böyük hesab edib adını zülm qoydular. Peyğəmbər və övliyaların adəti belədir ki, kiçik olan günahı da böyük hesab edərlər. Amma çox böyük olan savabı kiçik və dəyərsiz bir şey kimi göstərərlər. Adəmin nəsli də gərək, öz babalarına tabe olsunlar. Günah etdikdə, gərək, Adəm kimi tez öz təqsirlərini etiraf edib tövbə etsinlər, nəinki Adəmin düşməni şeytan kimi təkəbbürlənib, günah içində qalıb asi və zalım olsunlar. Babasını qoyub, onun düşməninə tabe olana naxələf övlad deyərlər. Mövlana Cəlaləddin Rumi nə gözəl deyir: "Ey üzü nurlu kişi böyük baban (Adəm)dən dərs al. O, İblis kimi təkəbbürlənmədi: "Rəbbim mən özümə zülm etdim",-dedi. Əlbəttə, gərək müsəlmanlar da Qurani-Şərifin hökmüylə babaları Adəmin yolu ilə getsinlər, amma Qurani-Şərifin hökmləri cəhalət zülməti altında gizlin qalıbdır. Dövrümüz elm və maarif zəmanəsi olduğu halda, əksinə, biz müsəlmanların günbəgün cəhalət və nadanlığı artıb və Qurani-Şərifin əmrləri hökmsüz qalıbdır. Bizim kimi müsəlmanlara müsəlman deyilməsə, yaxşıdır. Çünki islamın, Quranın adını, gözəl yolunu xarab və məhv etmişik).*

**24) (**قَالَ اهْبِطُوا بَعْضُكُمْ لِبَعْضٍ عَدُوٌّ**) – Allah-Təala buyurdu: "Ey şeytan, ey Adəm və Həvva, o müqəddəs məqamdan bir-birinizlə düşmən olduğunuz halda əskik olan məqama enin. Şeytan sizə, siz şeytana düşmən olub yer üzündə qalacaqsınız.** (وَلَكُمْ فِي الْاَرْضِ مُسْتَقَرٌّ وَمَتَاعٌ اِلٰى حِينٍ) **– sizin üçün yer üzündə ömrünüzün sonuna kimi yerləşmə, məişət və güzəran vardır".**

**25) (**قَالَ فِيهَا تَحْيَوْنَ**)** – (bu ayədə Adəmə və nəslinə onun xitab edib buyurur:) **ey Adəm övladı, yer üzündə həyat taparsınız,** (bundan sonra övladlarınız da

وَفِيهَا تَمُوتُونَ وَمِنْهَا تُخْرَجُونَ ۟ ﴿٢٥﴾ يَا بَنِيٓ اٰدَمَ قَدْ اَنْزَلْنَا عَلَيْكُمْ لِبَاسًا يُوَارِي سَوْاٰتِكُمْ وَرِيشًاۜ
وَلِبَاسُ التَّقْوٰى ذٰلِكَ خَيْرٌۜ ذٰلِكَ مِنْ اٰيَاتِ اللّٰهِ لَعَلَّهُمْ يَذَّكَّرُونَ ﴿٢٦﴾ يَا بَنِيٓ اٰدَمَ لَا يَفْتِنَنَّكُمُ الشَّيْطَانُ
كَمَآ اَخْرَجَ اَبَوَيْكُمْ مِنَ الْجَنَّةِ يَنْزِعُ عَنْهُمَا لِبَاسَهُمَا لِيُرِيَهُمَا سَوْاٰتِهِمَاۜ اِنَّهُ يَرٰيكُمْ هُوَ وَقَبِيلُهُ مِنْ حَيْثُ
لَا تَرَوْنَهُمْۜ اِنَّا جَعَلْنَا الشَّيَاطِينَ اَوْلِيَآءَ لِلَّذِينَ لَا يُؤْمِنُونَ ﴿٢٧﴾

---

yer üzündə güzəran keçirərlər). (وَفِيهَا تَمُوتُونَ) – **o yerdə də ölərsiniz.** (وَمِنْهَا تُخْرَجُونَ) **– elə o yerdə yenə Allah-Təala sizi dirildib, qiyamət gününə çıxarsınız.**

**26)** (يَا بَنِيٓ اٰدَمَ قَدْ اَنْزَلْنَا عَلَيْكُمْ لِبَاسًا) – **ey Adəm övladı, həqiqətən, sizə libas göndərdik. (Yəni o şeyləri ki, ondan libas əmələ gəlir, onları da sizdən ötrü yaratdıq. Hz. Adəmin özü və özündən xeyli sonra övladları da heyvan dərisi ilə örtünürdülər. İran sultanı Cəmşidin zamanında Allah-Təalanın insana əmanət verdiyi elmin gücü ilə toxuculuq kəşf olundu).** (يُوَارِي سَوْاٰتِكُمْ) **– o libas sizi və eyib yerlərinizi gizlədər.** (وَرِيشًاۜ) – **yenə sizdən ötrü bəzəkli libaslar yaratdıq,** (onları geymək sizdən ötrü zinət olsun). (وَلِبَاسُ التَّقْوٰى) – **bir də sizə təqva libasını verdik.** (Yəni Allah-Təalaya ibadət edib gözəl xüsusiyyətlərə sahib olmaq, necə ki libas insanı dünyada isti və soyuqdan qoruyur, ya da ondan ötrü zinət olursa, habelə Allaha ibadət və itaət və gözəl xüsusiyyətlər axirətdə insanı əzabdan qoruduğu və ondan ötrü axirət zinəti olduğu üçün ona da libas deyilir). (ذٰلِكَ خَيْرٌۜ) – **bu təqva libası dünya libaslarından yaxşıdır, dünya libasları isti və soyuqdan qoruyar, amma təqva** (axirət) **libası axirət əzabından mühafizə edər, axirət evində zinət verər.** (ذٰلِكَ مِنْ اٰيَاتِ اللّٰهِ) – **bu,** (Adəm övladı üçün libas yaratmaq) **Allah-Təalanın qüdrətinin əlamətlərindəndir. (Öz lütf və rəhmətindən insanı heyvanlar kimi etməyib, onlardan ötrü libas yaratdı).** (لَعَلَّهُمْ يَذَّكَّرُونَ) – **əlbəttə, insanlar libasın böyük nemət olduğuna agah olub və onun faydasına fikir verib, gərək, Allah-Təalaya şükür etsinlər.**

**27)** (يَا بَنِيٓ اٰدَمَ لَا يَفْتِنَنَّكُمُ الشَّيْطَانُ) – **ey Adəm övladı, şeytan** (xəbis nəfsi-əmmarə) **sizi fitnə-fəsada salıb Allah-Təalanın itaətindən çıxarmasın. O zaman cənnətə daxil ola bilməzsiniz.** (كَمَآ اَخْرَجَ اَبَوَيْكُمْ مِنَ الْجَنَّةِ ) – **ata-ananızı** (Adəm və Həvvanı) **cənnətdən çıxarıb, çöllərə salıb,** (يَنْزِعُ عَنْهُمَا لِبَاسَهُمَا) – **onlara vəsvəsə verib, təqva, Allaha itaət libasını onlardan çıxartdı ki,** (لِيُرِيَهُمَا سَوْاٰتِهِمَا) – **onları Allaha itaətdən uzaq edib, eyib yerlərini onlara göstərsin. O zaman da lüt-üryan gəzmək onlardan ötrü çətin olsun. Ey Adəm övladı, ata-ananızın belə düşmənindən çəkinməzsinizmi?** (اِنَّهُ يَرٰيكُمْ هُوَ وَقَبِيلُهُ مِنْ حَيْثُ لَا تَرَوْنَهُمْ) – **o sizə elə bir düşməndir ki, həqiqətən, şeytanın özü və yoldaşları** (xəbis nəfsi-əmmarə və onun qoşunları: qəzəb, şəhvət, təkəbbür, qürur, kin və ədavət və bunlardan başqa olan xəbis xüsusiyyətlər) **sizi görürlər, amma siz onları görməzsiniz.** (اِنَّا جَعَلْنَا الشَّيَاطِينَ اَوْلِيَآءَ لِلَّذِينَ لَا يُؤْمِنُونَ) – **həqiqətən, biz**

وَاِذَا فَعَلُوا فَاحِشَةً قَالُوا وَجَدْنَا عَلَيْهَٓا اٰبَٓاءَنَا وَاللّٰهُ اَمَرَنَا بِهَاۜ قُلْ اِنَّ اللّٰهَ لَا يَأْمُرُ بِالْفَحْشَٓاءِۜ اَتَقُولُونَ عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ ﴿٢٨﴾ قُلْ اَمَرَ رَبّ۪ي بِالْقِسْطِۙ وَاَق۪يمُوا وُجُوهَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ وَادْعُوهُ مُخْلِص۪ينَ لَهُ الدّ۪ينَۜ كَمَا بَدَاَكُمْ تَعُودُونَۜ ﴿٢٩﴾ فَر۪يقًا هَدٰى وَفَر۪يقًا حَقَّ عَلَيْهِمُ الضَّلَالَةُۜ اِنَّهُمُ اتَّخَذُوا الشَّيَاط۪ينَ اَوْلِيَٓاءَ مِنْ دُونِ اللّٰهِ وَيَحْسَبُونَ اَنَّهُمْ مُهْتَدُونَ ﴿٣٠﴾ يَا بَن۪ٓي اٰدَمَ خُذُوا ز۪ينَتَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ

---

**şeytanları öz əməlləri səbəbi ilə Allah-Təalaya iman gətirməyən şəxslərə dost etdik ki, şeytanın vəsvəsəsinə qulaq assınlar. Amma şeytan mömin şəxslərdən birdəfəlik uzaq olub heç vaxt möminlərə hakim bilməz.**

**28) (وَاِذَا فَعَلُوا فَاحِشَةً) – şeytana tabe olan şəxslər qəbih bir əməl edəndə, əgər onlara desən ki, etdiyiniz bu qəbih əməl nədir? (قَالُوا وَجَدْنَا عَلَيْهَٓا اٰبَٓاءَنَا) – cavabda deyərlər: "İki səbəbdən biz bu əməli edirik. Birincisi budur ki, ata-babalarımızı bu əməlləri edən görüb biz də onlara tabe olub təqlid eləmişik.** (Bunun cavabı odur ki, ata-babanın yanlış olan yolunu təqlid etmək batildir). **(وَاللّٰهُ اَمَرَنَا بِهَا) – ikincisi budur ki, Allah-Təala bizə bu qəbih əməli əmr edibdir".** (Bunun cavabında Allah-Təala buyurur:) **(قُلْ اِنَّ اللّٰهَ لَا يَأْمُرُ بِالْفَحْشَٓاءِ)** – (ey Məhəmməd)**, onlara de ki, Allah-Təalaya iftira edirsiniz. Həqiqətən, Allah-Təala heç vaxt pis və qəbih əməli əmr etməz. Bu xüsusiyyəti Allah-Təalaya isnad etmək zülmdür. (اَتَقُولُونَ عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ) – Allah-Təalaya o sözü isnad edirsiniz ki, ona elminiz yoxdur? Cəhalət və nadanlıq sizə qalib olub, o səbəbdən Allah-Təalaya qəbih xüsusiyyətləri isnad edirsiniz?**

**29) (قُلْ اَمَرَ رَبّ۪ي بِالْقِسْطِۙ)** – (ey Məhəmməd)**, de ki, mənim rəbbim belə qəbih sözləri əmr etməz. Əksinə. ədalət üzrə rəftar etməyi əmr edibdir. (وَاَق۪يمُوا وُجُوهَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ) – namaz vaxtı hər dəfə səcdə edəndə üzünüzü Allah-Təala tərəfinə tutun. Allah-Təaladan başqa heç bir şəxsə üz tutmayın. (وَادْعُوهُ مُخْلِص۪ينَ) – təkcə Allah-Təalanı çağırıb ixlasla ona ibadət edin. (لَهُ الدّ۪ينَ) – itaət və ibadət Allah-Təalaya məxsusdur. Ondan başqasına ibadət edilməz. (كَمَا بَدَاَكُمْ) – necə ki sizi ilk dəfə dünyaya gətiribdir, (تَعُودُونَ) – yenə qiyamətdə qayıdıb, əvvəlki kimi dirilərsiniz.**

**30) (فَر۪يقًا هَدٰى) – Allah-Təala bir qrupa** (öz ixtiyarları ilə imana gələnlərə) **hidayət etdi, (وَفَر۪يقًا حَقَّ عَلَيْهِمُ الضَّلَالَةُ) – başqa bir qrupa** (öz ixtiyarları ilə zəlaləti hidayətə üstün tutanlara) **da zəlalətdə qalmaq layiq oldu. (اِنَّهُمُ اتَّخَذُوا الشَّيَاط۪ينَ اَوْلِيَٓاءَ مِنْ دُونِ اللّٰهِ) – həqiqətən, zəlalətdə qalan şəxslər Allah-Təaladan başqa şeytanlara itaət edib, onları özlərinə dost tutdular və Allah-Təalanın itaətindən çıxdılar. (وَيَحْسَبُونَ اَنَّهُمْ مُهْتَدُونَ) – amma elə güman edirlər ki, hidayətdədirlər. Əksinə, hidayətdən birdəfəlik uzaqlaşıblar.**

**31) (يَا بَن۪ٓي اٰدَمَ خُذُوا ز۪ينَتَكُمْ عِنْدَ كُلِّ مَسْجِدٍ) – ey Adəm övladı, hər dəfə namaz qılıb səcdə edərkən zinətli libaslarınızı geyinin.** (Allah-Təala gözəl

وَكُلُوا وَاشْرَبُوا وَلَا تُسْرِفُواۚ اِنَّهُ لَا يُحِبُّ الْمُسْرِفِينَۙ ﴿٣١﴾ قُلْ مَنْ حَرَّمَ زِينَةَ اللّٰهِ الَّتِيٓ اَخْرَجَ لِعِبَادِهِ
وَالطَّيِّبَاتِ مِنَ الرِّزْقِۜ قُلْ هِيَ لِلَّذِينَ اٰمَنُوا فِي الْحَيٰوةِ الدُّنْيَا خَالِصَةً يَوْمَ الْقِيٰمَةِۜ كَذٰلِكَ نُفَصِّلُ الْاٰيَاتِ
لِقَوْمٍ يَعْلَمُونَ ﴿٣٢﴾ قُلْ اِنَّمَا حَرَّمَ رَبِّيَ الْفَوَاحِشَ مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ

---

libasları və dadlı yeməkləri haram etməyibdir. Bəzəkli libaslardan və dadlı yeməklərdən nə yesəniz də, sizə bir zərəri yoxdur. Amma yeyərkən bir mətləbə riayət edin ki, sizə faydası olsun, o mətləb də budur ki, yeyərkən israf etməyin, iştahdan artıq yeməyin, necə ki buyurur)**:** **(وَكُلُوا) – Allah-Təalanın yaxşı nemətlərindən yeyin. (وَاشْرَبُوا) – Allah-Təalanın yaratdığı dadlı sulardan için. (وَلَا تُسْرِفُوا) – amma yeyib-içməkdə* israf etməyin. İştahanızdan artıq yeməyin ki, bədəninizə zərər və naxoşluq düçar olmasın. (اِنَّهُ لَا يُحِبُّ الْمُسْرِفِينَ) – həqiqətən, Allah-Təala israf edən şəxsləri sevməz.**

*(****Qeyd:*** *Harun ər-Rəşidin xristian bir həkimi var idi. O həkim Əli ibn Hüseyn ibn Vaqid adlı alimdən soruşdu: "Sizin Quranda tibb elmindən heç bir şey yoxdur, halbuki elm 2 qisimdir: din elmi və bədən elmi. Quranda din elmi var, amma bədən elmi yoxdur". Fəzilətli alim Əli ibn Hüseyn dedi: "Allah-Təala bütün tibb elmini Qurani-Şərifin bir ayəsinin yarısında toplayıbdır". Həkim dedi: "Hansı ayədir?" Alim cavab verdi: "Yeyin, için, ancaq israf etməyin" ayəsidir. Həkim dedi: "Amma peyğəmbərinizdən tibb elminə dair bir şey yoxdur". Alim dedi: "Bizim peyğəmbərimiz tibb elmini bir neçə müxtəsər kəlmədə cəm edibdir". Həkim soruşdu: "O kəlmələr hansıdır?" Alim dedi: "Peyğəmbərimiz buyurubdur ki, mədə xəstəlik evidir," (yəni bütün xəstəliklər mədəni doldurub çox yeməkdən yaranar, mədəni çox yeməkdən qorumaq ən birinci dərmandır, hər bir bədən hansı qidaya adət edibsə, o şəkildə qidalandırın). Həkim dedi: "Sizin Quranınız və peyğəmbəriniz tibb elmində Qalendən ötrü bir şey qoymayıbdır").*

**32) (قُلْ مَنْ حَرَّمَ زِينَةَ اللّٰهِ الَّتِيٓ اَخْرَجَ لِعِبَادِهِ)** – (ey Məhəmməd)**, de ki, Allah-Təalanın öz bəndələrindən ötrü çıxarıb yaratdığı zinətləri kim sizə haram edibdir? ( وَالطَّيِّبَاتِ مِنَ الرِّزْقِ) – Allah-Təalanın ruzilərindən pak olan şeyləri kim sizə haram edibdir? Allah-Təala bu nemətlərin heç birini haram etməyibdir. (قُلْ هِيَ لِلَّذِينَ اٰمَنُوا فِي الْحَيٰوةِ الدُّنْيَا)** – (ey Məhəmməd)**, de ki, bu nemətlər dünyada möminlərdən ötrüdür. Kafirlər və müşriklər də onlarla nemətlərdə şərikdirlər. (خَالِصَةً يَوْمَ الْقِيٰمَةِ) – amma qiyamət günündə bu nemətlər ancaq möminlərdən ötrüdür. Kafir və müşriklərə ondan heç bir hissə və pay yoxdur. (كَذٰلِكَ) – habelə qeyd olundu, (نُفَصِّلُ الْاٰيَاتِ لِقَوْمٍ يَعْلَمُونَ) – elm sahibi olub Allah-Təalaya şərik qoşmayan şəxslərdən ötrü halal və haramı bəyan edirik ki, Allah-Təalanın halalını halal və haramını haram etsinlər.**

**33) (قُلْ اِنَّمَا حَرَّمَ رَبِّيَ الْفَوَاحِشَ)** – (ey Məhəmməd)**, de ki, həqiqətən, mənim rəbbim böyük günahları (zina, homoseksuallıq, adam öldürmək, oğurluq, yalandan and içmək kimi günahları) haram edibdir. (مَا ظَهَرَ مِنْهَا وَمَا بَطَنَ)**

وَالْاِثْمَ وَالْبَغْيَ بِغَيْرِ الْحَقِّ وَاَنْ تُشْرِكُوا بِاللّٰهِ مَا لَمْ يُنَزِّلْ بِهٖ سُلْطَانًا وَاَنْ تَقُولُوا عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ
﴿٣٣﴾ وَلِكُلِّ اُمَّةٍ اَجَلٌ فَاِذَا جَٓاءَ اَجَلُهُمْ لَا يَسْتَأْخِرُونَ سَاعَةً وَلَا يَسْتَقْدِمُونَ ﴿٣٤﴾ يَا بَنٖيٓ اٰدَمَ اِمَّا
يَأْتِيَنَّكُمْ رُسُلٌ مِنْكُمْ يَقُصُّونَ عَلَيْكُمْ اٰيَاتٖي فَمَنِ اتَّقٰى وَاَصْلَحَ فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ ﴿٣٥﴾

---

**– gizlində və aşkarda, hər iki halda bu günahları etmək sizə haramdır. (وَالْاِثْمَ) – və yenə sizə kiçik günahları haram edib. (وَالْبَغْيَ بِغَيْرِ الْحَقِّ) – nahaq* zülm etməyi sizə haram edibdir. (وَاَنْ تُشْرِكُوا بِاللّٰهِ مَا لَمْ يُنَزِّلْ بِهٖ سُلْطَانًا) – Allah-Təala sizə heç bir dəlil göndərmədiyi halda, onları Allah-Təalaya şərik qoşmanızı sizə haram edibdir. Bəs niyə Allah-Təalaya şərik qoşursunuz? (وَاَنْ تَقُولُوا عَلَى اللّٰهِ مَا لَا تَعْلَمُونَ) – yenə Allah-Təala yalandan iftira edib Allah-Təalaya isnad etdiyiniz şeyləri sizə haram edibdir.**

*(**Qeyd:** Günahların haram olduğunu bir yerdə qeyd edəndən sonra zülm ilə Allah-Təalaya şərik qoşmağın bir yerdə qeyd edilməsi bu iki işin son dərəcə qəbih olmasına işarədir. Heç bir pis əməl bu iki şeydən daha pis ola bilməz. Zülmün ilk dərəcəsi Allah-Təalaya şərik qoşmaqdır. Ondan sonra hətta heyvan da olsa, məxluqata zülm etmək son dərəcə qəbihdir. İnsana layiq deyil ki, adını insan qoyub, amma zalımlığı özünə şüar etsin. Belə şəxsə insan demək olmaz. Şeyx Sədi necə də gözəl deyir:*

*Bir zalımı gördüm ki, günorta yatıb,*
*Dedim ki, bu fitnədir, yatsa yaxşıdır.*
*Çünki onun yatması oyaq olmasından daha yaxşıdır,*
*Belə yaşamaqdansa ölmək yaxşıdır.)*

**34) (وَلِكُلِّ اُمَّةٍ اَجَلٌ) – Allah-Təalanın peyğəmbər göndərdiyi hər bir ümmətdən ötrü təyin edilmiş bir vaxt vardır, o müəyyən vaxta qədər Allah-Təala onlara möhlət verər. Əgər iman gətirməsələr, o müəyyən vaxt çatandan sonra onlara əzab göndərər.** (Necə ki buyurur:) **(فَاِذَا جَٓاءَ اَجَلُهُمْ لَا يَسْتَأْخِرُونَ سَاعَةً وَلَا يَسْتَقْدِمُونَ) – nə zaman o iman gətirməyən ümmətin təyin edilmiş vaxtı gəlib çatsa, ondan sonra onlara əzab nazil olar. O təyin edilmiş vaxtdan sonra onların əzabı nə bir saat irəliyə çəkilər nə də bir saat geri qalar.** (Məkkə əhlinə Allah-Təala möhlət verdi, iman gətirmədilər, möhlətləri bitəndən sonra Allah-Təala onları müsəlmanların əllərində zəlil etdi).

**35) (يَا بَنٖيٓ اٰدَمَ اِمَّا يَأْتِيَنَّكُمْ رُسُلٌ مِنْكُمْ) – ey Adəm övladı, əgər sizə bizim tərəfimizdən öz cinsinizdən peyğəmbərlər gəlib, (يَقُصُّونَ عَلَيْكُمْ اٰيَاتٖي) – bizim ayə və ehkamlarımızı sizə yetirsələr, (فَمَنِ اتَّقٰى وَاَصْلَحَ) – o vaxt kim peyğəmbərlərə tabe olub, qorxub yaxşı əməllər etsə, (فَلَا خَوْفٌ عَلَيْهِمْ وَلَا هُمْ يَحْزَنُونَ) – belə şəxslərə qiyamət gününün əzabından nə qorxu vardır, nə də qəmgin olmazlar.**

وَالَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا وَاسْتَكْبَرُوا عَنْهَٓا اُولٰئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فِيهَا خَالِدُونَ﴿٣٦﴾ فَمَنْ اَظْلَمُ مِمَّنِ
افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا اَوْ كَذَّبَ بِاٰيَاتِهٖۜ اُولٰئِكَ يَنَالُهُمْ نَصِيبُهُمْ مِنَ الْكِتَابِۜ حَتّٰٓى اِذَا جَٓاءَتْهُمْ رُسُلُنَا يَتَوَفَّوْنَهُمْۙ
قَالُوٓا اَيْنَ مَا كُنْتُمْ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِۜ قَالُوا ضَلُّوا عَنَّا وَشَهِدُوا عَلٰٓى اَنْفُسِهِمْ اَنَّهُمْ كَانُوا كَافِرِينَ ﴿٣٧﴾
قَالَ ادْخُلُوا فٖٓي اُمَمٍ قَدْ خَلَتْ مِنْ قَبْلِكُمْ مِنَ الْجِنِّ وَالْاِنْسِ فِي النَّارِۜ كُلَّمَا دَخَلَتْ اُمَّةٌ لَعَنَتْ اُخْتَهَاۜ
حَتّٰٓى اِذَا ادَّارَكُوا فِيهَا جَمِيعًاۙ قَالَتْ اُخْرٰيهُمْ لِاُو۫لٰيهُمْ رَبَّنَا هٰٓؤُ۬لَٓاءِ اَضَلُّونَا فَاٰتِهِمْ عَذَابًا ضِعْفًا مِنَ النَّارِۜ
قَالَ لِكُلٍّ ضِعْفٌ

---

**36)** (وَالَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا) – **o şəxslər ki peyğəmbərlərə iman gətirməyib, ayələrimizi təkzib edib,** (وَاسْتَكْبَرُوا عَنْهَٓا) – **onlara qarşı təkəbbürlənir,** (اُولٰئِكَ اَصْحَابُ النَّارِۚ هُمْ فِيهَا خَالِدُونَ) – **onlar cəhənnəm odunun yoldaşlarıdır və həmişə cəhənnəm odunda qalıb, heç vaxt ordan çıxmazlar.**

**37)** (فَمَنْ اَظْلَمُ مِمَّنِ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا اَوْ كَذَّبَ بِاٰيَاتِهٖۜ) – **Allah-Təalaya iftira edib, yalan isnad edib, ya da onun ayələrini təkzib edən şəxslərdən daha zalım olan kimdir?** (اُولٰئِكَ يَنَالُهُمْ نَصِيبُهُمْ مِنَ الْكِتَابِ) – **bu qeyd olunan şəxslərə dünyada onlardan ötrü yazılıb təyin edilən ömürləri və ruziləri yetişər.** (حَتّٰٓى اِذَا جَٓاءَتْهُمْ رُسُلُنَا يَتَوَفَّوْنَهُمْ) – **o zamana qədər ki, onlara göndərdiyimiz mələklər gəlib, onları vəfat etdirər.** (قَالُوٓا اَيْنَ مَا كُنْتُمْ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ) – **mələklər onların ruhlarını alanda onlara deyərlər: "Allah-Təaladan başqa çağırıb Ona şərik qoşduğunuz o şeylər haradadır? Bugünkü gündə qoy gəlib sizə kömək olsunlar".** (قَالُوا ضَلُّوا عَنَّا) – **onlar cavabda deyərlər: "Allah-Təalaya şərik qoşduğumuz şeylərin hamısı bizdən qeyb oldu, onları görmürük ki, bizə kömək olsunlar".** (وَشَهِدُوا عَلٰٓى اَنْفُسِهِمْ اَنَّهُمْ كَانُوا كَافِرِينَ) – (ey Məhəmməd), **bu sözlərlə özlərinin zərərinə dünyada kafir olduqlarına şəhadət edərlər.**

**38)** (قَالَ ادْخُلُوا فٖٓي اُمَمٍ قَدْ خَلَتْ مِنْ قَبْلِكُمْ مِنَ الْجِنِّ وَالْاِنْسِ فِي النَّارِ) – (Allah-Təala müşrik və kafirlərə buyurur:) **sizdən əvvəlki cin və insan ümmətləri ilə birlikdə cəhənnəm oduna siz də daxil olun.** (كُلَّمَا دَخَلَتْ اُمَّةٌ لَعَنَتْ اُخْتَهَا) – **elə ki cəhənnəmə daxil olarlar, girən hər ümmət tabe olduğu yoldaşına onun səbəbinə zəlalətə düşdüyü üçün lənət edər.** (حَتّٰٓى اِذَا ادَّارَكُوا فِيهَا جَمِيعًا) – **o zamana gələn ki, bir-birilərinin dalınca cəhənnəmə daxil olub toplanarlar.** (قَالَتْ اُخْرٰيهُمْ لِاُو۫لٰيهُمْ) – **o vaxt tabe olan ümmət böyük və rəhbər olan ümmətin haqqında belə deyər:** (رَبَّنَا هٰٓؤُ۬لَٓاءِ اَضَلُّونَا) – **"Ey bizim rəbbimiz, bu böyüklər və rəislər bizi zəlalətə salıb haqq yolundan uzaqlaşdırdılar.** (فَاٰتِهِمْ عَذَابًا ضِعْفًا مِنَ النَّارِ) – **ilahi, bizi zəlalətə salan bu böyüklərimizə cəhənnəm odunun əzabından qat-qat artıq ver".** (قَالَ لِكُلٍّ ضِعْفٌ) – **onların cavabında Allah-Təala buyurur: "Həm sizə, həm rəislərə qat-qat artıq əzab edərəm,** (rəislərə ona görə ki, özləri zəlalətdə qalıb sizi də zəlalətə saldılar və sizə də ondan ötrü ki, mən sizə ağıl və şüur vermişdim, dünyada sizə lazım idi ki, haqq

وَلٰكِنْ لَا تَعْلَمُونَ ﴿٣٨﴾ وَقَالَتْ اُو۫لٰيهُمْ لِاُخْرٰيهُمْ فَمَا كَانَ لَكُمْ عَلَيْنَا مِنْ فَضْلٍ فَذُوقُوا الْعَذَابَ
بِمَا كُنْتُمْ تَكْسِبُونَ ﴿٣٩﴾ اِنَّ الَّذ۪ينَ كَذَّبُوا بِاٰيَاتِنَا وَاسْتَكْبَرُوا عَنْهَا لَا تُفَتَّحُ لَهُمْ اَبْوَابُ السَّمَٓاءِ
وَلَا يَدْخُلُونَ الْجَنَّةَ حَتّٰى يَلِجَ الْجَمَلُ ف۪ي سَمِّ الْخِيَاطِ وَكَذٰلِكَ نَجْزِي الْمُجْرِم۪ينَ ﴿٤٠﴾ لَهُمْ
مِنْ جَهَنَّمَ مِهَادٌ وَمِنْ فَوْقِهِمْ غَوَاشٍ وَكَذٰلِكَ نَجْزِي الظَّالِم۪ينَ ﴿٤١﴾ وَالَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا
الصَّالِحَاتِ لَا نُكَلِّفُ نَفْسًا اِلَّا وُسْعَهَٓا اُو۬لٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِ هُمْ ف۪يهَا خَالِدُونَ ﴿٤٢﴾

---

söz deyən şəxslərə tabe olasınız, ağıl səbəbinə haqqı batildən fərqləndirəsiniz. Nəinki hər səsi çıxana tabe olub qoyun kimi onun dalınca gedəsiniz. Bu səbəbdən sizə qat-qat artıq əzab edərəm). **(وَلٰكِنْ لَا تَعْلَمُونَ) – amma siz bilmirsiniz ki, Allah-Təala sizdən ötrü necə əzablar hazır edibdir?"**

**39) (وَقَالَتْ اُو۫لٰيهُمْ لِاُخْرٰيهُمْ) – o vaxt rəislər özlərinə tabe olanlara deyərlər: "(فَمَا كَانَ لَكُمْ عَلَيْنَا مِنْ فَضْلٍ) – Sizin bizdən bir üstünlüyünüz olmadı ki, ona görə sizin əzabınız bizdən az olsun. (فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْسِبُونَ) – dünyada qazadığınız o əməllərin səbəbinə cəhənnəm əzabını dadın,** (hər bir şəxs öz əməlinin cəzasını çəkər, biz rəislər sizi zorla özümüzə tabe etmədik. Öz ixtiyarınızla bizə tabe oldunuz. İndi hər bir şəxs öz əməlinin cəzasını çəksin)".

**40) (اِنَّ الَّذ۪ينَ كَذَّبُوا بِاٰيَاتِنَا) – həqiqətən, o şəxslər ki bizim ayələrimizi və Qurani-Şərifi təkzib edib, (وَاسْتَكْبَرُوا عَنْهَا) – təkəbbürlənib Qurana iman gətirmədi, (لَا تُفَتَّحُ لَهُمْ اَبْوَابُ السَّمَٓاءِ) – onların əməllərindən ötrü səmaların qapıları açılmaz və onların əməllərinə baxılmaz. Necə ki möminlərin əməllərindən ötrü səmaların qapıları açılıb mələklər o əməlləri qarşılayar. (وَلَا يَدْخُلُونَ الْجَنَّةَ) – özləri də cənnətə daxil olmazlar. (حَتّٰى يَلِجَ الْجَمَلُ ف۪ي سَمِّ الْخِيَاطِ) – dəvə iynənin gözündən keçənə qədər onların behiştə daxil olması imkansızdır,** (əgər dəvə iynənin deşiyindən keçsə, onlar da behiştə daxil olarlar. Dəvənin iynənin gözündən keçməsi necə imkansızdırsa, onların da behiştə daxil olması elə imkansızdır. Bir şeyin imkansız olduğunu anlatmaq üçün bu cür məsəllər qeyd olunur). **(وَكَذٰلِكَ نَجْزِي الْمُجْرِم۪ينَ) – habelə günahkar şəxslərə cəza verib cənnəti onlara haram edərik.**

**41) ( لَهُمْ مِنْ جَهَنَّمَ مِهَادٌ) – cəhənnəmin odu zalımları elə əhatə edər ki, sanki onlardan ötrü cəhənnəm odundan döşək olar, (وَمِنْ فَوْقِهِمْ غَوَاشٍ) – və üstlərinə örtmək üçün cəhənnəm odundan yorğan olar. Cəhənnəm odu hər tərəfdən zalımları əhatə edər. (وَكَذٰلِكَ نَجْزِي الظَّالِم۪ينَ) – zalım şəxslərə belə cəza verərik.**

**42) (وَالَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ) – o şəxslər ki iman gətirib yaxşı əməllər edir, (لَا نُكَلِّفُ نَفْسًا اِلَّا وُسْعَهَٓا) – əməl etməkdə heç kimə öz gücünün üstündə yük yükləmərik, (اُو۬لٰٓئِكَ اَصْحَابُ الْجَنَّةِ هُمْ ف۪يهَا خَالِدُونَ) – iman gətirib gücü çatdığı**

وَنَزَعْنَا مَا فٖي صُدُورِهِمْ مِنْ غِلٍّ تَجْرٖي مِنْ تَحْتِهِمُ الْاَنْهَارُۚ وَقَالُوا الْحَمْدُ لِلّٰهِ الَّذٖي هَدٰينَا
لِهٰذَا وَمَا كُنَّا لِنَهْتَدِيَ لَوْلَٓا اَنْ هَدٰينَا اللّٰهُۚ لَقَدْ جَٓاءَتْ رُسُلُ رَبِّنَا بِالْحَقِّۜ وَنُودُٓوا اَنْ تِلْكُمُ الْجَنَّةُ
اُورِثْتُمُوهَا بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٤٣﴾ وَنَادٰٓى اَصْحَابُ الْجَنَّةِ اَصْحَابَ النَّارِ اَنْ قَدْ وَجَدْنَا
مَا وَعَدَنَا رَبُّنَا حَقًّا فَهَلْ وَجَدْتُمْ مَا وَعَدَ رَبُّكُمْ حَقًّاۜ قَالُوا نَعَمْۚ فَاَذَّنَ مُؤَذِّنٌ بَيْنَهُمْ اَنْ لَعْنَةُ اللّٰهِ
عَلَى الظَّالِمٖينَۙ ﴿٤٤﴾

---

**qədər əməl edənlər behişt yoldaşlarıdır, həmişə behiştdə olub oradan çıxmazlar.**

**43) (وَنَزَعْنَا مَا فٖي صُدُورِهِمْ مِنْ غِلٍّ) – behiştə daxil olan möminlərin dünyada kin, ədavətə bais olan xüsusiyyətlərini** (qəzəb və şəhvət) **onların sinələrindən çəkib götürərik, dünyada olan pis xüsusiyyətlər daha behiştdə onlarda olmaz. (تَجْرٖي مِنْ تَحْتِهِمُ الْاَنْهَارُۚ) – behiştdə onların qəsrlərinin altından çaylar axar. (وَقَالُوا الْحَمْدُ لِلّٰهِ الَّذٖي هَدٰينَا لِهٰذَا) – behiştdə Allah-Təalanın həmd-sənası ilə məşğul olub belə deyərlər: "Həmd-səna o Allah-Təalaya layiqdir ki, bizi iman tərəfinə hidayət etdi". Belə ki belə nemətlərə vasil olduq. (وَمَا كُنَّا لِنَهْتَدِيَ لَوْلَٓا اَنْ هَدٰينَا اللّٰهُۚ) – əgər Allah-Təala bizə hidayət etməsəydi, biz hidayət tapan olmazdıq. (لَقَدْ جَٓاءَتْ رُسُلُ رَبِّنَا بِالْحَقِّ) – həqiqətən, bizim rəbbimizin peyğəmbərləri haqq ilə bizə gəldilər, onların gəlməsi Allah-Təalanın bizə lütf və mərhəməti oldu ki, hidayət tapıb belə nemətlərə vasil olduq".** (Bu sözləri behiştdə çox şad olduqlarından deyərlər. Necə ki nemət sahibi dünyada öz şadlığından nemətlərini sayar). **(وَنُودُٓوا اَنْ تِلْكُمُ الْجَنَّةُ) – Allah-Təala tərəfindən behişt əhlinə müraciət olunub onlara deyilər: "Bu behişt sizindir. (اُورِثْتُمُوهَا بِمَا كُنْتُمْ تَعْمَلُونَ) – dünyada etdiyiniz yaxşı əməllərin səbəbinə bu behiştə sahib oldunuz".** (Yəni behişt əməlin qarşılığıdır, Allah-Təala əməl olmadan behişti bəxş etməz).

**44) (وَنَادٰٓى اَصْحَابُ الْجَنَّةِ اَصْحَابَ النَّارِ) – behiştdə olanlar cəhənnəmdə olanları çağırıb deyərlər: (اَنْ قَدْ وَجَدْنَا مَا وَعَدَنَا رَبُّنَا حَقًّا) – "**(ey cəhənnəm əhli)**, həqiqətən, rəbbimizin bizə verdiyi vədi** (yaxşı əməl sahibini behiştə daxil etmək vədini) **biz haqq olaraq gördük, Allah-Təala vədinə vəfa etdi. (فَهَلْ وَجَدْتُمْ مَا وَعَدَ رَبُّكُمْ حَقًّاۜ) – bəs rəbbiniz Allah-Təalanın sizə vəd etdiyini** (pis əməl sahibini cəhənnəmə daxil etmək vədini) **haqq olaraq gördünüzmü?" (قَالُوا نَعَمْ)** – (cəhənnəm əhli cavabda) **deyərlər: "Bəli, (Allah-Təalanın vədini haqq olaraq gördük, budur, öz əməllərimizin səbəbinə cəhənnəmdə bizə əzab edir). (فَاَذَّنَ مُؤَذِّنٌ بَيْنَهُمْ اَنْ لَعْنَةُ اللّٰهِ عَلَى الظَّالِمٖينَ) – bu sual-cavabdan sonra Allah-Təala tərəfindən bir carçı behişt və cəhənnəm əhlinin arasında müraciət edib belə deyər: "Allah-Təalanın lənəti zalım şəxslərə olsun".** (O vaxt cəhənnəm əhli nicat tapmaqdan birdəfəlik məyus olar)**.**

اَلَّذِينَ يَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ وَيَبْغُونَهَا عِوَجًاۚ وَهُمْ بِالْاٰخِرَةِ كَافِرُونَۘ ﴿٤٥﴾ وَبَيْنَهُمَا حِجَابٌۚ وَعَلَى الْاَعْرَافِ رِجَالٌ يَعْرِفُونَ كُلًّا بِسِيمٰيهُمْۚ وَنَادَوْا اَصْحَابَ الْجَنَّةِ اَنْ سَلَامٌ عَلَيْكُمْ لَمْ يَدْخُلُوهَا وَهُمْ يَطْمَعُونَ ﴿٤٦﴾ وَاِذَا صُرِفَتْ اَبْصَارُهُمْ تِلْقَٓاءَ اَصْحَابِ النَّارِۙ قَالُوا رَبَّنَا لَا تَجْعَلْنَا مَعَ الْقَوْمِ الظَّالِمِينَۚ ﴿٤٧﴾ وَنَادٰٓى اَصْحَابُ الْاَعْرَافِ رِجَالًا يَعْرِفُونَهُمْ بِسِيمٰيهُمْ قَالُوا مَٓا اَغْنٰى عَنْكُمْ جَمْعُكُمْ وَمَا كُنْتُمْ تَسْتَكْبِرُونَ﴿٤٨﴾

---

**45) (اَلَّذِينَ يَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ وَيَبْغُونَهَا عِوَجًاۚ) – zalımların xüsusiyyətlərindən biri budur: xalqın Allah-Təalanın dininə daxil olmasına mane olub, Allah-Təalanın din və ehkamını dəyişdirməyə cəhd edib ondan ötrü bir əyrilik axtararlar. Belə ki avam insanları aldadıb öz ətraflarına toplasınlar.** (Bu ayə din və millət rəhbərlərinin barəsindədir, çünki avam insanlar onlara itaət edib sözlərinə qulaq asarlar). **(وَهُمْ بِالْاٰخِرَةِ كَافِرُونَ) – və halbuki o zalımlar özləri axirətə inanmırlar,** (hərçənd zahirdə özlərini axirətə etiqad edən göstərirlər, axirətə etiqadı olan şəxs belə əməllər etməz).

**46) (وَبَيْنَهُمَا حِجَابٌ) – behişt əhliylə cəhənnəm əhlinin arasında o sual-cavabdan sonra bir pərdə olar, daha bir-birilərini görməzlər,** (amma bəzən bir-birilərini görüb danışmağa izinləri olar). ***(وَعَلَى الْاَعْرَافِ رِجَالٌ) - Ərafda bəzi insanlar olar, (يَعْرِفُونَ كُلًّا بِسِيمٰيهُمْ) – Ərafda olan insanlar behişt və cəhənnəm əhlinin hər birini öz əlamətləriylə tanıyarlar. (وَنَادَوْا اَصْحَابَ الْجَنَّةِ) – Ərafda olanlar behişt əhlini çağırıb deyərlər: "(اَنْ سَلَامٌ عَلَيْكُمْ) – Allah-Təalanın salamı sizə olsun, əzabdan nicat tapıb əbədi olan nemətə qovuşdunuz". (لَمْ يَدْخُلُوهَا وَهُمْ يَطْمَعُونَ) – Əraf əhli bu sözü hələ behiştə daxil olmadıqları halda deyərlər, amma istəkləri odur ki, behiştə daxil olsunlar.** (Bu kəlam Allah-Təaladan Əraf əhli üçün bir ümiddir ki, bəlkə də Allah-Təala onları behiştə daxil edər).

*(****Qeyd:*** *Əraf - behiştlə cəhənnəm arasında bir məqamdır, oranın əhli əmin-amanlıqda olarlar. Cəhənnəmdən xilas olsalar da, behiştə daxil olmağı da istəyərlər).*

**47) (وَاِذَا صُرِفَتْ اَبْصَارُهُمْ تِلْقَٓاءَ اَصْحَابِ النَّارِۙ) – nə zaman Ərafda olanların nəzərləri cəhənnəm əhlinin tərəfinə çevrilsə** (Allah-Təala çevirsə), **onları əzabda görərlər. (قَالُوا رَبَّنَا لَا تَجْعَلْنَا مَعَ الْقَوْمِ الظَّالِمِينَ) – o vaxt da deyərlər: "Ey bizim rəbbimiz, bizi bu zalım olan camaatla bir yerdə tutma. Bizim üçün Ərafda olmaq daha yaxşıdır".**

**48) (وَنَادٰٓى اَصْحَابُ الْاَعْرَافِ رِجَالًا يَعْرِفُونَهُمْ بِسِيمٰيهُمْ) – Əraf əhli cəhənnəmdə tanıdıqları bəzi şəxsləri çağırarlar, (قَالُوا مَٓا اَغْنٰى عَنْكُمْ جَمْعُكُمْ) – çağırandan sonra deyərlər: "Hanı, dünyada yığdığınız mallarınız bu gün sizə bir fayda vermədi. (وَمَا كُنْتُمْ تَسْتَكْبِرُونَ) – təkəbbürlənməniz də sizə bir fayda vermədi".**

اَهٰؤُلَٓاءِ الَّذٖينَ اَقْسَمْتُمْ لَا يَنَالُهُمُ اللّٰهُ بِرَحْمَةٍۜ اُدْخُلُوا الْجَنَّةَ لَا خَوْفٌ عَلَيْكُمْ وَلَٓا اَنْتُمْ تَحْزَنُونَ ﴿٤٩﴾
وَنَادٰٓى اَصْحَابُ النَّارِ اَصْحَابَ الْجَنَّةِ اَنْ اَفٖيضُوا عَلَيْنَا مِنَ الْمَٓاءِ اَوْ مِمَّا رَزَقَكُمُ اللّٰهُۜ قَالُوٓا اِنَّ اللّٰهَ
حَرَّمَهُمَا عَلَى الْكَافِرٖينَۙ ﴿٥٠﴾ اَلَّذٖينَ اتَّخَذُوا دٖينَهُمْ لَهْوًا وَلَعِبًا وَغَرَّتْهُمُ الْحَيٰوةُ الدُّنْيَاۚ فَالْيَوْمَ نَنْسٰيهُمْ
كَمَا نَسُوا لِقَٓاءَ يَوْمِهِمْ هٰذَاۙ وَمَا كَانُوا بِاٰيَاتِنَا يَجْحَدُونَ ﴿٥١﴾ وَلَقَدْ جِئْنَاهُمْ بِكِتَابٍ فَصَّلْنَاهُ عَلٰى عِلْمٍ
هُدًى وَرَحْمَةً لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٥٢﴾

---

**49) (اَهٰؤُلَٓاءِ الَّذٖينَ اَقْسَمْتُمْ لَا يَنَالُهُمُ اللّٰهُ بِرَحْمَةٍ) – yenə Ərafda olanlar cəhənnəm əhlinə deyərlər: "Ey cəhənnəmdəki rəislər, bu behişt əhlinə baxın, bəs bunlardan ötrü dünyada and içib deyirdiniz ki, Allah-Təalanın rəhməti bunlara yetişməyib bunları behiştə daxil etməz? İndi sizə məlum oldu ki, behiştə daxil olmaq dünyada böyük olmaqla, təkəbbür etməklə deyilmiş, bəlkə cənnətə daxil olmağın səbəbi iman imiş? (اُدْخُلُوا الْجَنَّةَ لَا خَوْفٌ عَلَيْكُمْ وَلَٓا اَنْتُمْ تَحْزَنُونَ)** – (bu sual-cavabdan sonra Allah-Təala tərəfindən Ərafda olan şəxslərə deyilər:) **cənnətə daxil olun, artıq sizdən ötrü nə bir qorxu var, nə də qəmgin olmazsınız, həmişə şadlıq, fərəh, sevinc içində olacaqsınız.** (İlahi, axirət nemətlərindən bizi binəsib etmə, amin!)

**50) (وَنَادٰٓى اَصْحَابُ النَّارِ اَصْحَابَ الْجَنَّةِ) – elə ki Əraf əhli cənnətə daxil oldu, cəhənnəm əhlinin də tamahı artar), cəhənnəm əhli behişt əhlini çağırıb deyər: (اَنْ اَفٖيضُوا عَلَيْنَا مِنَ الْمَٓاءِ اَوْ مِمَّا رَزَقَكُمُ اللّٰهُ) – "Ey behişt əhli, bizə rəhm edib behiştin suyundan, ya da Allah-Təalanın sizə ruzi olaraq verdiyi yeməklərdən bizə də ehsan edin. (قَالُوٓا اِنَّ اللّٰهَ حَرَّمَهُمَا عَلَى الْكَافِرٖينَ) – behişt əhli onların cavabında deyərlər: "Allah-Təala behiştin suyunu və nemətlərini kafirlərə haram edibdir. Cəhənnəmdə olanlar kafirdirlər. Allah-Təalanın nemətini onlara vermək olmaz".**

**51) (اَلَّذٖينَ اتَّخَذُوا دٖينَهُمْ لَهْوًا وَلَعِبًا) – o şəxslər ki dünyada din və məzhəblərini oyun-oyuncaq** (əyləncə) **edib, (وَغَرَّتْهُمُ الْحَيٰوةُ الدُّنْيَا) – dünya həyatı onları aldadıb Allah-Təalanı unutdular. (فَالْيَوْمَ نَنْسٰيهُمْ) – bu gün qiyamət günündə biz də onları unudarıq. (كَمَا نَسُوا لِقَٓاءَ يَوْمِهِمْ هٰذَا) – necə ki dünyada onlar bugünkü günlə qarşılaşmağı unutmuşdular. (وَمَا كَانُوا بِاٰيَاتِنَا يَجْحَدُونَ) – onlar bizim ayə və ehkamlarımızı inkar etdikləri üçün biz də onları unutduq.**

**52) (وَلَقَدْ جِئْنَاهُمْ بِكِتَابٍ) – həqiqətən, axirəti inkar edənlərə bizim peyğəmbərimiz mötəbər olan bir kitabla** (Quranla) **gəldi. (فَصَّلْنَاهُ عَلٰى عِلْمٍ) – müqəddəs zatımızda olan elm üzrə o kitabın ayə və ehkamlarını təfsilatı ilə bəyan etdik. (هُدًى وَرَحْمَةً لِقَوْمٍ يُؤْمِنُونَ) – Quran imana daxil olanlardan ötrü hidayət və rəhmətdir, bununla belə, bu Quranı inkar edib qəbul etmirlər, halbuki gərək elmə tabe olsunlar.**

**هَلْ يَنْظُرُونَ اِلَّا تَاْوِيلَهُ ۜ يَوْمَ يَاْتِي تَاْوِيلُهُ يَقُولُ الَّذِينَ نَسُوهُ مِنْ قَبْلُ قَدْ جَٓاءَتْ رُسُلُ رَبِّنَا بِالْحَقِّ ۚ فَهَلْ لَنَا مِنْ شُفَعَٓاءَ فَيَشْفَعُوا لَنَٓا اَوْ نُرَدُّ فَنَعْمَلَ غَيْرَ الَّذِي كُنَّا نَعْمَلُ ۜ قَدْ خَسِرُوٓا اَنْفُسَهُمْ وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ ۚ ﴿٥٣﴾ اِنَّ رَبَّكُمُ اللّٰهُ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ فِي سِتَّةِ اَيَّامٍ ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِ يُغْشِي الَّيْلَ النَّهَارَ يَطْلُبُهُ حَثِيثًاۙ وَالشَّمْسَ وَالْقَمَرَ وَالنُّجُومَ مُسَخَّرَاتٍ بِاَمْرِهِ**

---

**53) (هَلْ يَنْظُرُونَ اِلَّا تَاْوِيلَهُ) –bu Quranı inkar edənlər Quranın axırının necə olacağını gözləyirlər ki, görsünlər onun sözləri doğru olur, yoxsa yox? (يَوْمَ يَاْتِي تَاْوِيلُهُ)** – **o günkü gündə** (qiyamət günündə) **ki, onun doğruluğu inkar edənlərdən ötrü zahir oldu, (يَقُولُ الَّذِينَ نَسُوهُ مِنْ قَبْلُ)** – **dünyada Quranı unudanlar deyərlər: (قَدْ جَٓاءَتْ رُسُلُ رَبِّنَا بِالْحَقِّ )** – **həqiqətən, dünyada rəbbimizin peyğəmbərləri haqq ilə bizə gəldilər.** (Amma heyif ki, biz qəbul etmədik, bugünkü gündə əzaba düçar olduq). **(فَهَلْ لَنَا مِنْ شُفَعَٓاءَ فَيَشْفَعُوا لَنَٓا)** – **bəs bizdən ötrü şəfaət edən olar ki, şəfaət etsin ki, əzabdan xilas olaq? (اَوْ نُرَدُّ فَنَعْمَلَ غَيْرَ الَّذِي كُنَّا نَعْمَلُ)** – **ya da bizi dünyaya qaytarsınlar ki, dünyada etdiyimiz pis əməllərdən başqa, yaxşı əməllər edək? (قَدْ خَسِرُوٓا اَنْفُسَهُمْ)** – **yalan deyirlər, həqiqətən, özlərinə zərər verdilər. Onlardan ötrü yenidən dünyaya qayıtmaq mümkün olmayıb, onlardan ötrü şəfaət edən də olmaz. (وَضَلَّ عَنْهُمْ مَا كَانُوا يَفْتَرُونَ)** – **Allah-Təalaya iftira edib yalandan isnad etdikləri şeyləri (məbudları, bütləri) onlardan qeyb olub* onlara bir kömək edən də olmaz.**

*(*Qeyd: Dünyada ehtiyacları üçün yardım istədikləri şeylərin qiyamətdə onlara bir faydası olmaz. Fayda verən ancaq Allah-Təaladır. Ondan başqa peyğəmbər, övliya və ya başqa bir şəxsdən kömək istəmək olmaz. Allah-Təaladan başqasına yönəlmək şirkdir. Vay olsun biz müsəlmanlara ki, seyidlərin, fəqihlərin daşdan, kəsəkdən, ağacdan hazırlanmış qədim məqbərələrini, türbələrini özümüzə rəhbər sayıb, Allah-Təalanı unutmuşuq. Allah-Təalanın halal etdyi heyvanları bu qeyd olunan batil məbudlar üçün qurban adıyla kəsib, haram edib ondan sonra da yeyirik, fikir vermək lazımdır).*

**54) (اِنَّ رَبَّكُمُ اللّٰهُ الَّذِي خَلَقَ السَّمٰوَاتِ وَالْاَرْضَ فِي سِتَّةِ اَيَّامٍ)** – **həqiqətən, sizin rəbbiniz elə Allah-Təaladır ki, səmaları və yeri** (təxminən) **6 gün içində yaratdı.** (gecə-gündüz səmaların və yerin yaradılmasından sonra yaradıldığı üçün ayədə keçən 6 gün ifadəsi təxmini olaraq göstərildi). **(ثُمَّ اسْتَوٰى عَلَى الْعَرْشِ)** –

*(*Qeyd: Ərş taxt mənasınadır, bu ayə Allah-Təalanın səmalara, yerə və onlarda olan məxluqata hakim olmasına işarədir. Necə ki adətən deyilər: filan padşah taxta çıxdı, yəni o məmləkətdə olan bütün məxluqata hakim oldu. Qurani-Şərifin ayələrindəki məfhumlar da adətdən kənar olmayıb, hamısı adət-ənənəyə uyğundur).*

**- ondan sonra Allah-Təala ərşə qalib və hakim oldu. (يُغْشِي الَّيْلَ النَّهَارَ)** – **gecəni gündüzə elə bir halda qatar ki, (يَطْلُبُهُ حَثِيثًاۙ)** – **sürətlə* bir-birilərini təqib edərlər. (وَالشَّمْسَ وَالْقَمَرَ وَالنُّجُومَ مُسَخَّرَاتٍ بِاَمْرِهِ)** – **Allah-Təala günəşi, ayı, ulduz-**

اَلَا لَهُ الْخَلْقُ وَالْاَمْرُ تَبَارَكَ اللّٰهُ رَبُّ الْعَالَمِينَ ﴿٥٤﴾ اُدْعُوا رَبَّكُمْ تَضَرُّعًا وَخُفْيَةً اِنَّهُ لَا يُحِبُّ
الْمُعْتَدِينَ ﴿٥٥﴾ وَلَا تُفْسِدُوا فِي الْاَرْضِ بَعْدَ اِصْلَاحِهَا وَادْعُوهُ خَوْفًا وَطَمَعًا اِنَّ رَحْمَتَ اللّٰهِ قَرِيبٌ
مِنَ الْمُحْسِنِينَ ﴿٥٦﴾

---

**ları elə bir halda yaratdı ki, onun qüdrətinə tabe olub, Allah-Təalanın hikməti necə istəsə, o cür olarlar.** (اَلَا لَهُ الْخَلْقُ وَالْاَمْرُ) – (ey insanlar), **xəbərdar olun ki, bütün şeylərin yaradılışı və hər bir işin idarəsi Allah-Təalaya məxsusdur.** (تَبَارَكَ اللّٰهُ رَبُّ الْعَالَمِينَ) – **bütün aləmlərə tərbiyə verən Allah-Təala çox xeyirli və bərəkətli olan Allah-Təaladır.**

*(*Qeyd: Gecə və gündüzün sürətlə gəlib getməsi qəflətdə olan insan ömrünün kəsilməsi deməkdir, ömür ağacı qəfildən kəsilib ayaqlar altında qalar.*

*Xoca kəmərinin bəndini nəqş edərkən, evi yıxılıb ayaq altında viranə oldu.*

*Aqil o şəxsdir ki, bugünkü işini sabaha qoymasın, özündən ötrü dünyada xeyirli bir ad qoysun. Xüsusən, var-dövlət sahibi olan şəxslər günah yığıb, özləriylə axirətə aparmasınlar. Xoş o şəxslərin halına ki, dünya malını din və millətin tərəqqisi yolunda, millətin övladlarını yetişdirmək üçün sərf edib, əbədiyyəti elə dünyada qazanırlar).*

**55)** (اُدْعُوا رَبَّكُمْ تَضَرُّعًا وَخُفْيَةً) – **yalvararaq və gizlin şəkildə* Allah-Təalanı çağırıb, hər bir ehtiyacınızı ondan istəyin. Duada ədəbə riayət edin. Fəryad edib çığırıb-bağırmayın.** (اِنَّهُ لَا يُحِبُّ الْمُعْتَدِينَ) – **həqiqətən, Allah-Təala duada həddi aşıb, çığıranları, ədəbsiz şəkildə dua edənləri sevməz.**

*(*Qeyd: Təəssüf ki, Qurani-Şərifin öyüd-nəsihətləri, məsələn, sərt daşa, qayaya təsir etdiyi halda, bizim qəlbimiz daşdan da sərt olub bizə heç nə təsir eləmir. Sadəcə mübarək günlərdə məscidlərə toplanıb, minbərdə olan fırıldaqçılar 100 rola girərək guya xalqa dua etdirərlər. Ədəbsiz şəkildə məsciddə səs-küy salıb, (Onlar sanki çöl-biyabanda can verən sərxoş və ya asma xəstəsidirlər) ucadan salavat dedizdirib, xalqın heyvanlar kimi nərə atmasını əmr edərlər. Heyvan təbiətli avam xalq da onların niyyətinə agah olmayıb, şeytanın vəkillərini Hz. Peyğəmbərin vəkili zənn edib, onların əmrlərini vəhy kimi hesab edib onlara tabe olarlar. Bəs nə zaman biz insanların cərgəsinə daxil olacağıq? Vay olsun bizə. Cahiliyyə zamanından betər günlərə gəlib çatdıq).*

**56)** (وَلَا تُفْسِدُوا فِي الْاَرْضِ بَعْدَ اِصْلَاحِهَا) – **Allah-Təala peyğəmbərlər göndərib yer üzünü islah edəndən sonra siz insanlar Allah-Təalaya asi olub, bir-birinizə zülm edib, yer üzündə fəsad törətməyin.** (وَادْعُوهُ خَوْفًا وَطَمَعًا) – **Allah-Təalanın qəzəbindən qorxub, rəhmətinə ümidvar olduğunuz halda, dua edib, Allah-Təalanı çağırın.** (Allah-Təala tövbə edənlərə rəhm edib onları bağışlayandır). (اِنَّ رَحْمَتَ اللّٰهِ قَرِيبٌ مِنَ الْمُحْسِنِينَ) – **həqiqətən, Allah-Təalanın rəhməti yaxşı əməl sahibi olan şəxslərə yaxındır. Heç vaxt onlardan uzaq olmaz.**

وَهُوَ الَّذٖي يُرْسِلُ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِهٖۜ حَتّٰٓى اِذَٓا اَقَلَّتْ سَحَابًا ثِقَالًا سُقْنَاهُ لِبَلَدٍ مَيِّتٍ فَاَنْزَلْنَا
بِهِ الْمَٓاءَ فَاَخْرَجْنَا بِهٖ مِنْ كُلِّ الثَّمَرَاتِۜ كَذٰلِكَ نُخْرِجُ الْمَوْتٰى لَعَلَّكُمْ تَذَكَّرُونَ ﴿٥٧﴾ وَالْبَلَدُ الطَّيِّبُ
يَخْرُجُ نَبَاتُهُ بِاِذْنِ رَبِّهٖۚ وَالَّذٖي خَبُثَ لَا يَخْرُجُ اِلَّا نَكِدًاۜ كَذٰلِكَ نُصَرِّفُ الْاٰيَاتِ لِقَوْمٍ يَشْكُرُونَ ۟﴿٥٨﴾

---

**57)** (وَهُوَ الَّذٖي يُرْسِلُ الرِّيَاحَ بُشْرًا بَيْنَ يَدَيْ رَحْمَتِهٖ) – **Allah-Təala külələri öz rəhmətinin** (yağış və qar) **önündə müjdəçi olaraq göndərər. Ta ki insanlar yağış və qarın gəlməsindən şad olsunlar.** (حَتّٰٓى اِذَٓا اَقَلَّتْ سَحَابًا ثِقَالًا) – **o küləklər yağış səbəbinə ağır olan buludları hərəkət etdirdiyi zaman onu nə suyu, nə də ot-ələfi olan ölü olan bir ölkənin mənfəəti üçün çəkib apararıq.** (سُقْنَاهُ لِبَلَدٍ مَيِّتٍ فَاَنْزَلْنَا بِهِ الْمَٓاءَ) – **o ölü ölkəyə o buludlardan su endirərik.** (فَاَخْرَجْنَا بِهٖ مِنْ كُلِّ الثَّمَرَاتِ) – **o suyun səbəbinə yerdən hər cür meyvələri çıxararıq.** (كَذٰلِكَ) – **bu ölü yeri dirildib ondan hər cür meyvə çıxardığımız kimi** (نُخْرِجُ الْمَوْتٰى) – **qiyamət günündə də bütün ölüləri yerdən çıxararıq.** (لَعَلَّكُمْ تَذَكَّرُونَ) – **bu ölü olan yerin dirildiyini görüb ibrət alın ki, Allah-Təala ölü yeri dirildib ondan hər cür meyvələr çıxartmağa qadir olduğu kimi, habelə insanı da öləndən sonra dirildib əvvəlki halına gətirməyə* qadirdir, bu iki ölünün dirilməsində heç bir fərq yoxdur.**

*(****Qeyd:** *Allah-Təalanın kamil qüdrəti bahar fəslində zahir olar. Vay olsun materialistlərə ki, növbənöv çiçəklərin baharda açmasını havaya, bahar fəslinə isnad edib, havanı müstəqil təsir edən hesab edirlər. Güman və zənn üzrə bir söz deyib yeganə olan Allah-Təalanın felini məxluqa isnad edirlər, halbuki eyni torpaqdan baş qaldıran o müxtəlif çiçəklərə insan ağlı heyran qalar.*

*Şeyx Sədi də bu barədə çox gözəl buyurub: Yaşıl ağac yarpaqlarının öz oxşaması, allahın varlığının birər dəftər səhifəsidir.)*

**58)** (وَالْبَلَدُ الطَّيِّبُ يَخْرُجُ نَبَاتُهُ بِاِذْنِ رَبِّهٖ) – **yaxşı torpağı olan ölkənin ot-ələfi Allah-Təalanın izniylə yağış səbəbinə gözəl olaraq çıxar.** (وَالَّذٖي خَبُثَ لَا يَخْرُجُ اِلَّا نَكِدًا) – **amma torpağı pis və quraq olan ölkənin ot-ələfi faydasız şəkildə çıxar.** (كَذٰلِكَ نُصَرِّفُ الْاٰيَاتِ لِقَوْمٍ يَشْكُرُونَ) – **öz vəhdaniyyətimizə və şəriksiz olmağımıza işarə edən açıq-aşkar dəlil və sübutları Allah-Təalanın nemətlərinə şükür edən bir camaatdan ötrü bəyan edirik.** (Bu ayə qəlbləri xəbis olan xüsusiyyətlərdən pak və saf olan, lakin hələ qəlblərində gözəl xüsusiyyətlərin yerləşmədiyi şəxslərdən ötrü bir məsəldir. Amma elə ki onların qulaqları Allah-Təalanın öyüd-nəsihətlərini eşitdi, qəlblərində də gözəl olan xüsusiyyətlər meydana gələr. O xüsusiyyətlər onlarda zahir olub, onları pis əməllərdən qoruyar, onlardan həmişə gözəl və yaxşı əməllər zahir olar. Bir də bu, qəlblərini xəbis olan xüsusiyyətlər səbəbi ilə kin-küdurət tutub heç bir öyüd-nəsihətin təsir etmədiyi şəxslərdən ötrü məsəldir).

لَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهٖ فَقَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُۜ اِنّٖٓي اَخَافُ عَلَيْكُمْ عَذَابَ
يَوْمٍ عَظٖيمٍ ﴿٥٩﴾ قَالَ الْمَلَاُ مِنْ قَوْمِهٖٓ اِنَّا لَنَرٰيكَ فٖي ضَلَالٍ مُبٖينٍ ﴿٦٠﴾ قَالَ يَا قَوْمِ لَيْسَ بٖي
ضَلَالَةٌ وَلٰكِنّٖي رَسُولٌ مِنْ رَبِّ الْعَالَمٖينَ ﴿٦١﴾ اُبَلِّغُكُمْ رِسَالَاتِ رَبّٖي وَاَنْصَحُ لَكُمْ وَاَعْلَمُ مِنَ
اللّٰهِ مَا لَا تَعْلَمُونَ ﴿٦٢﴾ اَوَعَجِبْتُمْ اَنْ جَٓاءَكُمْ ذِكْرٌ مِنْ رَبِّكُمْ عَلٰى رَجُلٍ مِنْكُمْ لِيُنْذِرَكُمْ وَلِتَتَّقُوا
وَلَعَلَّكُمْ تُرْحَمُونَ ﴿٦٣﴾

---

**59) (لَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهٖ)** – (ey Məhəmməd)**, həqiqətən Nuhu öz qövmünə peyğəmbər göndərdik.** (Bu ayə və bundan sonra gələn ayələrdə həm şərəfli bir elm olan tarix bəyan olunur, həm də Hz. Peyğəmbərə təsəlli verilir, yəni ey Məhəmməd, bütün peyğəmbərlərə öz qövmləri əziyyət edib. Necə ki onlar səbir ediblər, sən də səbir et. Axırda onlara qalib gələcəksən). **(فَقَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ) – Nuh dedi: "Ey qövm, ancaq bir olan Allah-Təalaya ibadət edin. (مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُۜ) – sizdən ötrü Allah-Təaladan başqa ibadətə layiq olan məbud yoxdur. (اِنّٖٓي اَخَافُ عَلَيْكُمْ عَذَابَ يَوْمٍ عَظٖيمٍ) – əgər Allah-Təalaya ibadət etməsəniz, həqiqətən, böyük olan bir günün** (qiyamət gününün) **əzabından qorxaram ki, o gün əzab sizi tutub həlak olasınız".**

**60) (قَالَ الْمَلَاُ مِنْ قَوْمِهٖٓ) – Nuhun cavabında camaatın böyükləri və rəisləri dedilər: "(اِنَّا لَنَرٰيكَ فٖي ضَلَالٍ مُبٖينٍ)** – (ey Nuh)**, həqiqətən, biz səni aşkar olan zəlalətdə və haqq yolundan tamam uzaq görürük".**

**61) (قَالَ يَا قَوْمِ لَيْسَ بٖي ضَلَالَةٌ) – Nuh dedi: "Ey qövm, məndə zəlalətdən və haqdan uzaq bir şey yoxdur, mənə iftira edirsiniz. (وَلٰكِنّٖي رَسُولٌ مِنْ رَبِّ الْعَالَمٖينَ) – lakin mən sizə aləmlərə tərbiyə verən rəbb Allah-Təala tərəfindən peyğəmbərəm,** (necə olar ki peyğəmbər zəlalətdə olsun. Peyğəmbər düz yolda olar).

**62) (اُبَلِّغُكُمْ رِسَالَاتِ رَبّٖي) – öz rəbbim Allah-Təalanın mənə əmr etdiyi hökmlərini sizə təbliğ edib çatdırıram. (وَاَنْصَحُ لَكُمْ) – sizə nəsihət edirəm ki, Allah-Təala tərəfinə qayıdasınız. (وَاَعْلَمُ مِنَ اللّٰهِ مَا لَا تَعْلَمُونَ) – Allah-Təalanın sifətlərindən və məxluqata hakim olan kamil qüdrətindən mən agah olduğum qədər siz agah deyilsiniz, gəlib mənə tabe olub Allah-Təalaya ibadət edin".**

**63) (اَوَعَجِبْتُمْ اَنْ جَٓاءَكُمْ ذِكْرٌ مِنْ رَبِّكُمْ عَلٰى رَجُلٍ مِنْكُمْ لِيُنْذِرَكُمْ وَلِتَتَّقُوا) – yoxsa rəbbiniz Allah-Təala tərəfindən sizi əzabla qorxudub, təqva sahibi olub günahlarınızı tərk edəsiniz deyə içinizdən bir kişinin** (Hz. Nuhun) **vasitəsilə sizə öyüd-nəsihət gəlməsinə təəccüb edirsiniz? (وَلَعَلَّكُمْ تُرْحَمُونَ) – əgər siz peyğəmbərə tabe olub imana gəlsəniz, əlbəttə, Allah-Təala da qiyamət günündə sizə rəhm edib, sizə əzabdan nicat verər.**

فَكَذَّبُوهُ فَاَنْجَيْنَاهُ وَالَّذِينَ مَعَهُ فِي الْفُلْكِ وَاَغْرَقْنَا الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَاۜ اِنَّهُمْ كَانُوا قَوْمًا عَمِينَ ۟﴿٦٤﴾
وَاِلٰى عَادٍ اَخَاهُمْ هُودًاۜ قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُۜ اَفَلَا تَتَّقُونَ ﴿٦٥﴾ قَالَ الْمَلَاُ الَّذِينَ
كَفَرُوا مِنْ قَوْمِهٖٓ اِنَّا لَنَرٰيكَ فِي سَفَاهَةٍ وَاِنَّا لَنَظُنُّكَ مِنَ الْكَاذِبِينَ﴿٦٦﴾ قَالَ يَا قَوْمِ لَيْسَ بِي سَفَاهَةٌ
وَلٰكِنِّي رَسُولٌ مِنْ رَبِّ الْعَالَمِينَ ﴿٦٧﴾ اُبَلِّغُكُمْ رِسَالَاتِ رَبِّي وَاَنَا لَكُمْ نَاصِحٌ اَمِينٌ ﴿٦٨﴾ اَوَعَجِبْتُمْ
اَنْ جَٓاءَكُمْ ذِكْرٌ مِنْ رَبِّكُمْ عَلٰى رَجُلٍ مِنْكُمْ لِيُنْذِرَكُمْۜ وَاذْكُرُٓوا اِذْ جَعَلَكُمْ خُلَفَٓاءَ مِنْ بَعْدِ قَوْمِ نُوحٍ

---

**64) (فَكَذَّبُوهُ) – Nuh peyğəmbərin sözlərini qəbul etməyib onu təkzib etdilər. (فَاَنْجَيْنَاهُ وَالَّذِينَ مَعَهُ فِي الْفُلْكِ)** – (ondan sonra onları tufan yaxaladı), **Nuhu və ona iman gətirib gəmidə olan şəxsləri tufandan xilas etdik. (وَاَغْرَقْنَا الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا) – amma bizim möcüzələrimizi və hökmlərimizi təkzib edən şəxsləri qərq etdik. (اِنَّهُمْ كَانُوا قَوْمًا عَمِينَ) – həqiqətən, o təkzib edənlər qəlbləri və gözləri haqqı dərk edib görməkdən kor olan camaat idi və bu səbəbdən onları əzab tutub həlak oldular.**

**65) (وَاِلٰى عَادٍ اَخَاهُمْ هُودًا) – Ad camaatına qardaşları Hudu peyğəmbər göndərdik. (قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ) – Hud onları dəvət edib dedi: "Ey camaat, sadəcə Allah-Təalaya ibadət edib ona şərik qoşmayın. ( مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ) – sizdən ötrü Allah-Təaladan başqa, haqq olan məbud yoxdur. (اَفَلَا تَتَّقُونَ) – Allah-Təalanın əzabından qorxmayıb, ondan başqasına ibadət edirsiniz?"**

**66) (قَالَ الْمَلَاُ الَّذِينَ كَفَرُوا مِنْ قَوْمِهٖٓ) – Hudun cavabında qövmündən kafir olan böyükləri və rəisləri dedilər: "(اِنَّا لَنَرٰيكَ فِي سَفَاهَةٍ) – həqiqətən, biz səni səfehlik içində ağılsız biri olaraq görürük. Ata-baba dinini tərk edib özgə dindən yapışıbsan. (وَاِنَّا لَنَظُنُّكَ مِنَ الْكَاذِبِينَ) – həqiqətən, peyğəmbərlik iddianda da biz sənin yalançılardan olduğunu güman edirik".**

**67) (قَالَ يَا قَوْمِ لَيْسَ بِي سَفَاهَةٌ) – Hud dedi: "Ey mənim qövmüm, məndə səfehlik və ağılsızlıq yoxdur. (وَلٰكِنِّي رَسُولٌ مِنْ رَبِّ الْعَالَمِينَ) – lakin mən sizə aləmlərə tərbiyə verən rəbb Allah-Təala tərəfindən peyğəmbər gəlmişəm. Peyğəmbərdə səfehlik olarmı?**

**68) (اُبَلِّغُكُمْ رِسَالَاتِ رَبِّي) – öz rəbbim Allah-Təalanın mənə əmr etdiyi hökmlərini sizə çatdırıram. (وَاَنَا لَكُمْ نَاصِحٌ اَمِينٌ) – mən sizdən ötrü əmin, nəsihət verən bir şəxsəm. Heç vaxt sizə xəyanət etmərəm".**

**69) (اَوَعَجِبْتُمْ اَنْ جَٓاءَكُمْ ذِكْرٌ مِنْ رَبِّكُمْ عَلٰى رَجُلٍ مِنْكُمْ لِيُنْذِرَكُمْ ) – yoxsa rəbbiniz Allah-Təala tərəfindən sizi qorxudub, Allah-Təala tərəfinə dəvət etsin deyə içinizdən bir şəxsin vasitəsilə** (Hudun vasitəsilə) **sizə öyüd-nəsihət gəlməsinə təəccüb edirsiniz? (وَاذْكُرُٓوا اِذْ جَعَلَكُمْ خُلَفَٓاءَ مِنْ بَعْدِ قَوْمِ نُوحٍ)** – (ey camaat), **yadınıza salın ki, Allah-Təala sizi yer üzündə Nuh qövmünə varis etdi,**

وَزَادَكُمْ فِي الْخَلْقِ بَصْطَةًۚ فَاذْكُرُوٓا اٰلَآءَ اللّٰهِ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٦٩﴾ قَالُوٓا اَجِئْتَنَا لِنَعْبُدَ اللّٰهَ وَحْدَهُ وَنَذَرَ
مَا كَانَ يَعْبُدُ اٰبَآؤُنَاۚ فَأْتِنَا بِمَا تَعِدُنَآ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ﴿٧٠﴾ قَالَ قَدْ وَقَعَ عَلَيْكُمْ مِنْ رَبِّكُمْ رِجْسٌ
وَغَضَبٌۜ اَتُجَادِلُونَنِي فِيٓ اَسْمَآءٍ سَمَّيْتُمُوهَآ اَنْتُمْ وَاٰبَآؤُكُمْ مَا نَزَّلَ اللّٰهُ بِهَا مِنْ سُلْطَانٍۜ فَانْتَظِرُوٓا اِنّٖي
مَعَكُمْ مِنَ الْمُنْتَظِرِينَ ﴿٧١﴾ فَاَنْجَيْنَاهُ وَالَّذِينَ مَعَهُ بِرَحْمَةٍ مِنَّا وَقَطَعْنَا دَابِرَ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا

---

(yer üzündə istədiyiniz kimi idarə edirsiniz). **(وَزَادَكُمْ فِي الْخَلْقِ بَصْطَةً) - Allah-Təala həm yaradılışda, həm ucalıqda, həm də qüvvətdə sizi digər camaatlara üstün etdi. Heç bir camaatı sizin kimi yaratmayıbdır. (فَاذْكُرُوٓا اٰلَآءَ اللّٰهِ) - Allah-Təalanın sizə bəxş etdiyi nemətlərini xatırlayıb, ona şükür edin. (لَعَلَّكُمْ تُفْلِحُونَ) - o vaxt əlbəttə, axirət əzabından nicat taparsınız.**

**70) (قَالُوٓا اَجِئْتَنَا لِنَعْبُدَ اللّٰهَ وَحْدَهُ) - dedilər: "Ey Hud, sən bizə gəlibsən ki, biz ancaq tək olan Allah-Təalaya ibadət edək? (وَنَذَرَ مَا كَانَ يَعْبُدُ اٰبَآؤُنَاۚ) - hansı ki o bütlərə ata-babalarımız ibadət edirdilər, onları tərk edək? (İnsanların əksəriyyətini təqlidçilik, ata-babanı həvəslə təqlid etmək həlak edibdir). (فَأْتِنَا بِمَا تَعِدُنَآ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ) - əgər doğru deyən şəxslərdənsənsə, bizə vəd etdiyin əzabı göstər".**

**71) (قَالَ قَدْ وَقَعَ عَلَيْكُمْ مِنْ رَبِّكُمْ رِجْسٌ وَغَضَبٌ) - Hud dedi: "Ey camaat, artıq sizə rəbbiniz Allah-Təala tərəfindən əzabın nazil olması layiqdir. (اَتُجَادِلُونَنِي فِيٓ اَسْمَآءٍ سَمَّيْتُمُوهَآ اَنْتُمْ وَاٰبَآؤُكُمْ) - ey camaat, siz və ata-babalarınızın onlara ad qoyub - bunlar bizim məbudlarımızdır, dediyiniz o bütlərin barəsində mənimlə mübahisə və münaqişə edirsiniz? (مَا نَزَّلَ اللّٰهُ بِهَا مِنْ سُلْطَانٍ) - Allah-Təala onların məbud olması barəsində heç bir dəlil və sübut göndərməyibdir.** (Gərək, hər bir əməldə Allah-Təalanın hökmünə itaət edək. Bu barədə Allah-Təalanın bir hökmü yoxdur). **(فَانْتَظِرُوٓا اِنّٖي مَعَكُمْ مِنَ الْمُنْتَظِرِينَ) - ey camaat, Allah-Təalanın əzabını gözləyin, sizinlə birlikdə mən də gözləyirəm ki, görək ilahi əzab nə vaxt sizə nazil olacaq?"**

**72) (فَاَنْجَيْنَاهُ وَالَّذِينَ مَعَهُ بِرَحْمَةٍ مِنَّا) - o camaata əzab göndərdik. Hud və onunla birlikdə Allah-Təalaya iman gətirən şəxslərə rəhmətimizlə əzabdan nicat verdik. (وَقَطَعْنَا دَابِرَ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا) - Hud* camaatından möcüzələrimizi və hökmlərimizi təkzib edənlərin kökünü kəsib, tamamən hamısını həlak etdik.**

*(****Qeyd:** Ad camaatının qissəsi müxtəsər şəkildə belədir: Ad camaatı Yəmən mülkündə Əmman və Hadramut arasında məskun idilər. Nuh tufanından sonra qalan camaatın nəslindən idilər. Allah-Təalaya asi olub bütpərəst oldular. Bütləri var idi. Birinin adı Suda, ikinci Səmud, 3-cü Həba idi. Allah-Təala Hudu onlara peyğəmbər göndərdi. (Hud ibn Saleh ibn Ərfaxd ibn Sam ibn Nuhdur). Hudu təkzib etdilər. Allah-Təala ibrət alıb iman gətirsinlər deyə 3 il onlara yağış göndərmədi. Yenə iman*

**وَمَا كَانُوا مُؤْمِنِينَ ﴿٧٢﴾ وَاِلٰى ثَمُودَ اَخَاهُمْ صَالِحًاۢ قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ ۜ قَدْ جَٓاءَتْكُمْ بَيِّنَةٌ مِنْ رَبِّكُمْ ۜ هٰذِهٖ نَاقَةُ اللّٰهِ لَكُمْ اٰيَةً فَذَرُوهَا تَأْكُلْ فٖيٓ اَرْضِ اللّٰهِ وَلَا تَمَسُّوهَا بِسُٓوءٍ فَيَاْخُذَكُمْ عَذَابٌ اَلٖيمٌ ﴿٧٣﴾ وَاذْكُرُٓوا اِذْ جَعَلَكُمْ خُلَفَٓاءَ مِنْ بَعْدِ عَادٍ وَبَوَّاَكُمْ فِي الْاَرْضِ تَتَّخِذُونَ مِنْ سُهُولِهَا قُصُورًا وَتَنْحِتُونَ الْجِبَالَ بُيُوتًاۚ فَاذْكُرُٓوا اٰلَٓاءَ اللّٰهِ وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدٖينَ ﴿٧٤﴾ قَالَ الْمَلَاُ الَّذٖينَ اسْتَكْبَرُوا مِنْ قَوْمِهٖ لِلَّذٖينَ اسْتُضْعِفُوا لِمَنْ اٰمَنَ مِنْهُمْ**

---

*gətirmədilər. 3 ildən sonra havada qara bulud zahir oldu, onlar elə güman etdilər ki, yağış bulududur. Bir müddət sonra gördülər ki, həmin buluddan şiddətli bir külək peyda oldu. 8 gün, 7 gecə o şiddətli külək əsib, hamısını həlak edib, bir nəfər də sağ qalmadı. Ancaq Hud və ona iman edən bir neçə nəfər buludu ilk gördüklərində o camaatın arasından çıxıb getmişdilər. Sonra Hud Məkkəyə gedib ölənə qədər orada qaldı).*

**Onlardan bir nəfər də sağ qalmadı. (وَمَا كَانُوا مُؤْمِنِينَ) – onlar küfr və inadlarında son dərəcə möhkəm olub Allah-Təalaya iman gətirən deyildilər.**

**73) (وَاِلٰى ثَمُودَ اَخَاهُمْ صَالِحًاۢ) – Səmud camaatına onların qardaşı Salehi peyğəmbər göndərdik. (قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ ۜ) – Saleh dedi: “Ey camaat, sadəcə Allah-Təalaya ibadət edib ona şərik qoşmayın. Sizdən ötrü Allah-Təaladan başqa, haqq olan məbud yoxdur. (قَدْ جَٓاءَتْكُمْ بَيِّنَةٌ مِنْ رَبِّكُمْ) – həqiqətən, rəbbiniz Allah-Təaladan mənim doğru olmağım haqda sizdən ötrü açıq-aşkar olan dəlil gəldi. (هٰذِهٖ نَاقَةُ اللّٰهِ لَكُمْ اٰيَةً) – o dəlil Allah-Təalanın bu dəvəsidir. Sizdən ötrü mənim doğru olmağıma bir möcüzədir. (فَذَرُوهَا تَأْكُلْ فٖيٓ اَرْضِ اللّٰهِ) – Allah-Təalanın bu dəvəsini buraxın Allah-Təalanın yerində ot-ələfdən yesin, ona əziyyət etməyin. (وَلَا تَمَسُّوهَا بِسُٓوءٍ) – o dəvəni vurub, ot-ələfdən, ya da sudan uzaq tutmaqla ona əziyyət etməyin. (فَيَاْخُذَكُمْ عَذَابٌ اَلٖيمٌ) – əgər ona əziyyət etsəniz, o vaxt Allah-Təalanın şiddətli əzabı sizi tutar.**

**74) (وَاذْكُرُٓوا اِذْ جَعَلَكُمْ خُلَفَٓاءَ مِنْ بَعْدِ عَادٍ) –** (ey camaat)**, yadınıza salın ki, Allah-Təala sizi yer üzündə Ad camaatından sonra varis etdi (ki, yer üzündə istədiyiniz kimi idarə edəsiniz). (وَبَوَّاَكُمْ فِي الْاَرْضِ) – yer üzündə** (Şam ilə Hicaz arasında) **sizə yurd verdi. (تَتَّخِذُونَ مِنْ سُهُولِهَا قُصُورًا) – özünüzdən ötrü həmin yerin torpağından hazırlanan** (kərpicdən) **yaxşı qəsrlər və imarətlər qurursunuz. (وَتَنْحِتُونَ الْجِبَالَ بُيُوتًا) – və dağları yonub, özünüzdən ötrü evlər düzəldirsiniz.** (Saleh qövmünün dağlardan yonub düzəltdikləri evlər Şamla Hicaz arasında indi də mövcuddur)**. (فَاذْكُرُٓوا اٰلَٓاءَ اللّٰهِ) – Allah-Təalanın sizə bəxş etdiyi nemətləri xatırlayın. (وَلَا تَعْثَوْا فِي الْاَرْضِ مُفْسِدٖينَ) – yer üzündə tüğyan edib, fəsad törətməyin. Əksinə həmişə islah edib, fəsadı tərk edin”.**

**75) (قَالَ الْمَلَاُ الَّذٖينَ اسْتَكْبَرُوا مِنْ قَوْمِهٖ) – Salehin cavabında onun qövmündən təkəbbürlü olan böyüklər və rəislər, (لِلَّذٖينَ اسْتُضْعِفُوا لِمَنْ اٰمَنَ مِنْهُمْ) – Salehin**

اَتَعْلَمُونَ اَنَّ صَالِحًا مُرْسَلٌ مِنْ رَبِّهٖ قَالُوٓا اِنَّا بِمَآ اُرْسِلَ بِهٖ مُؤْمِنُونَ﴿٧٥﴾ قَالَ الَّذٖينَ اسْتَكْبَرُوٓا اِنَّا
بِالَّذٖيٓ اٰمَنْتُمْ بِهٖ كَافِرُونَ ﴿٧٦﴾ فَعَقَرُوا النَّاقَةَ وَعَتَوْا عَنْ اَمْرِ رَبِّهِمْ وَقَالُوا يَا صَالِحُ ائْتِنَا بِمَا تَعِدُنَآ اِنْ
كُنْتَ مِنَ الْمُرْسَلٖينَ ﴿٧٧﴾ فَاَخَذَتْهُمُ الرَّجْفَةُ فَاَصْبَحُوا فٖي دَارِهِمْ جَاثِمٖينَ ﴿٧٨﴾ فَتَوَلّٰى عَنْهُمْ وَقَالَ
يَا قَوْمِ لَقَدْ اَبْلَغْتُكُمْ رِسَالَةَ رَبّٖي وَنَصَحْتُ لَكُمْ وَلٰكِنْ لَا تُحِبُّونَ النَّاصِحٖينَ ﴿٧٩﴾

---

**özünə etina etməyib Salehə iman gətirən zəif şəxslərə dedilər: “(اَتَعْلَمُونَ) (اَنَّ صَالِحًا مُرْسَلٌ مِنْ رَبِّهٖ) – Bəs siz bilirsiniz ki, həqiqətən, bu Saleh öz rəbbi Allah-Təala tərəfindən göndərilən peyğəmbərdir?”** (Bu sözü istehza məqsədilə dedilər). **(قَالُوٓا اِنَّا بِمَآ اُرْسِلَ بِهٖ مُؤْمِنُونَ) – iman gətirənlər dedilər: “Onda şübhə yoxdur ki, Saleh Allah-Təala tərəfindən göndərilən peyğəmbərdir, həqiqətən, o hökmlər ki, Saleh onları təbliğ etməyə göndərilibdir, biz ona iman gətirmişik”.**

**76) (قَالَ الَّذٖينَ اسْتَكْبَرُوٓا) – təkəbbürlənib iman gətirməyənlər dedilər: “(اِنَّا) (بِالَّذٖيٓ اٰمَنْتُمْ بِهٖ كَافِرُونَ) – Həqiqətən, o şəxsə ki siz iman gətiribsiniz, biz onu inkar edib heç vaxt Salehə iman gətirmərik”.**

**77) (فَعَقَرُوا النَّاقَةَ وَعَتَوْا عَنْ اَمْرِ رَبِّهِمْ) – iman gətirməyənlər öz rəbləri Allah-Təalanın əmrinə asi olub, dəvənin ayaq damarını kəsib onu qətlə yetirdilər. (وَقَالُوا يَا صَالِحُ ائْتِنَا بِمَا تَعِدُنَآ اِنْ كُنْتَ مِنَ الْمُرْسَلٖينَ) – dedilər: “Ey Saleh, əgər sən Allah-Təala tərəfindən göndərilən peyğəmbərlərdənsənsə, bizə vəd etdiyin o əzabı bizə gətir”.**

**78) (فَاَخَذَتْهُمُ الرَّجْفَةُ) – onlara əzab nazil olub şiddətli səslə olan zəlzələ onları yaxalayıb, hamısı həlak oldular. (فَاَصْبَحُوا فٖي دَارِهِمْ جَاثِمٖينَ) – hamısı öz yerlərində və evlərində sağ-salamat oturduqları halda, dizləri üstə çöküb həlak oldular.**

**79) (فَتَوَلّٰى عَنْهُمْ) – elə ki Saleh öz qövmünə əzabın nazil olduğunu gördü, onlardan üz döndərib, (وَقَالَ يَا قَوْمِ لَقَدْ اَبْلَغْتُكُمْ رِسَالَةَ رَبّٖي) – təəssüflə dedi: “Ey qövm, həqiqətən, mən sizə öz rəbbimin peyğəmbərliyini və ehkamını çatdırdım. (وَنَصَحْتُ لَكُمْ) – və sizə nəsihət etdim ki, gəlib Allah-Təalaya iman gətirib itaət edin. (وَلٰكِنْ لَا تُحِبُّونَ النَّاصِحٖينَ) – lakin siz nəsihət edən şəxsləri sevməzdiniz, budur, öz əməlinizin cəzası sizə* çatdı”.**

*(*__Qeyd:__ Səmud camaatının qissəsi müxtəsər şəkildə belədir: Səmud tayfası ərəblərdən olub, Şamla Hicaz arasında sakin idi. Tüğyan edib Allaha itaətdən çıxıb, bütpərəst oldular. Allah-Təala onlara özlərindən olan Salehi peyəmbər göndərdi. (Saleh ibn Übeyd ibn Asəf ibn Masih ibn Übeyd ibn Səmud ibn Abir ibn Ərəm ibn Sam ibn Nuhdur). Saleh onları dəvət etsə də qəbul etmədilər. Ondan sonra Salehdən möcüzə istədilər ki, bu böyük daşdan bizdən ötrü bir dəvə çıxart. Bu şərtlə ki, o dəvə gələndən sonra özü böyüklükdə də bir bala doğsun. Allah-Təala istədikləri kimi o*

وَلُوطًا اِذْ قَالَ لِقَوْمِهٖٓ اَتَاْتُونَ الْفَاحِشَةَ مَا سَبَقَكُمْ بِهَا مِنْ اَحَدٍ مِنَ الْعَالَم۪ينَ ﴿٨٠﴾ اِنَّكُمْ لَتَاْتُونَ الرِّجَالَ
شَهْوَةً مِنْ دُونِ النِّسَٓاءِۜ بَلْ اَنْتُمْ قَوْمٌ مُسْرِفُونَ ﴿٨١﴾ وَمَا كَانَ جَوَابَ قَوْمِهٖٓ اِلَّٓا اَنْ قَالُوٓا اَخْرِجُوهُمْ مِنْ
قَرْيَتِكُمْۚ اِنَّهُمْ اُنَاسٌ يَتَطَهَّرُونَ ﴿٨٢﴾ فَاَنْجَيْنَاهُ وَاَهْلَهُٓ اِلَّا امْرَاَتَهُۘ كَانَتْ مِنَ الْغَابِر۪ينَ ﴿٨٣﴾ وَاَمْطَرْنَا
عَلَيْهِمْ مَطَرًاۜ فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُجْرِم۪ينَ ﴿٨٤﴾

---

*dəvəni Salehə möcüzə olaraq verdi, yenə iman gətirmədilər, axırda o dəvəni qətlə yetirdilər, Saleh də onlara dedi: “3 gün gözləyin, ondan sonra sizə əzab gələcək, ilk gün üzünüz saralacaq, 2-ci gün qırmızı olacaq, 3-cü gün qara olacaq, o zaman da sizə əzab gələcək”. Elə ki 3-cü gün oldu, üzləri qaraldı. Əzabın gələcəyinə inandılar. Saleh onların arasından çıxıb, Fələstin tərəfinə getdi. Şiddətli bir səslə zəlzələ olub, tamamən hamısı həlak oldu).*

**80) (وَلُوطًا) – Lutu Şam torpağında** (Sodom) **camaatına peyğəmbər göndərdik. (اِذْ قَالَ لِقَوْمِهٖٓ) – o zaman ki öz qövmünə dedi: “(اَتَاْتُونَ الْفَاحِشَةَ) – Bəs siz son dərəcə pis və qəbih olan əməllər edirsiniz?** (ən qəbih əməl olan homoseksuallıq edirdilər)**. (مَا سَبَقَكُمْ بِهَا مِنْ اَحَدٍ مِنَ الْعَالَم۪ينَ) – sizdən əvvəlki millətlərdən heç kimin etmədiyi o pis əməlləri siz edirsiniz?**

**81) (اِنَّكُمْ لَتَاْتُونَ الرِّجَالَ شَهْوَةً مِنْ دُونِ النِّسَٓاءِۜ) – o qəbih əməl budur, bəs siz heç Allah-Təaladan həya etmirsiniz? Qadınları tərk edib öz nəfsani istəkləriniz üçün özünüz kimi kişilərlə əlaqəyə girirsiniz? Halbuki qadınlar nəsli artıqmaq üçün yaradılıbdır, onları tərk edib kişilərə gedirsiniz. (بَلْ اَنْتُمْ قَوْمٌ مُسْرِفُونَ) – əslində, siz Allah-Təalanın qoyduğu həddi aşan camaatsınız. Qadınları qoyub ehtiyacınızı kişilərlə təmin edirsiniz.**

**82) (وَمَا كَانَ جَوَابَ قَوْمِهٖٓ اِلَّٓا اَنْ قَالُوٓا اَخْرِجُوهُمْ مِنْ قَرْيَتِكُمْ) – Lut qövmü Luta deyəcək bir cavab tapmadılar, ancaq bir-birilərinə dedilər: “Lutun özünü və qövmünü öz qəsəbənizdən qovun. (اِنَّهُمْ اُنَاسٌ يَتَطَهَّرُونَ) – onlar özlərini pak hesab edən şəxslərdirlər, gərək, bizdən uzaq olsunlar,** (Bu sözü istehza məqsədilə dedilər)**.**

**83) (فَاَنْجَيْنَاهُ وَاَهْلَهُٓ اِلَّا امْرَاَتَهُ) – Lut qövmünə əzab göndərdik, Lutun özünə və ailəsinə əzabdan nicat verdik. Ancaq xanımı nicat tapmayıb, (كَانَتْ مِنَ الْغَابِر۪ينَ) – camaatın arasında qalıb həlak olanlardan oldu.**

**84) (وَاَمْطَرْنَا عَلَيْهِمْ مَطَرًاۜ) – əvvəlcə onlara yağış kimi daş yağdırdıq. Ondan sonra onları zəlzələ yaxalayıb, hamısı yerə qərq oldu. (فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُجْرِم۪ينَ) –** (ey Məhəmməd)**, bax gör ki, günahkar şəxslərin axırı necə oldu və onları necə ilahi əzab yaxalayıb həlak oldular.***

*(*__Qeyd:__ Lut Hz. İbrahimin qardaşı Haranın oğludur. Hz. İbrahim Babildən hicrət edib Şama gələndə, Lut da Allah-Təala tərəfindən Fələstində Sodom camaatına göndərildi. Sodom 7 şəhərdən ibarət idi. O bölgə xalqı homoseksuallığa aludə idi.*

وَاِلٰى مَدْيَنَ اَخَاهُمْ شُعَيْبًاۜ قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُۜ قَدْ جَٓاءَتْكُمْ بَيِّنَةٌ مِنْ رَبِّكُمْ
فَاَوْفُوا الْكَيْلَ وَالْمِيزَانَ وَلَا تَبْخَسُوا النَّاسَ اَشْيَٓاءَهُمْ وَلَا تُفْسِدُوا فِي الْاَرْضِ بَعْدَ اِصْلَاحِهَاۜ ذٰلِكُمْ
خَيْرٌ لَكُمْ اِنْ كُنْتُمْ مُؤْمِنِينَۚ ﴿٨٥﴾ وَلَا تَقْعُدُوا بِكُلِّ صِرَاطٍ تُوعِدُونَ وَتَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ مَنْ
اٰمَنَ بِه۪ وَتَبْغُونَهَا عِوَجًاۚ وَاذْكُرُٓوا اِذْ كُنْتُمْ قَلِيلًا فَكَثَّرَكُمْۖ وَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُفْسِد۪ينَ ﴿٨٦﴾
وَاِنْ كَانَ طَٓائِفَةٌ مِنْكُمْ اٰمَنُوا بِالَّذ۪يٓ اُرْسِلْتُ بِه۪

---

*Yoldan keçən şəxsləri də tutub onlarla homoseksuallıq edirdilər. Qadınları tamamən tərk etmişdilər. Elə ki qadınlar kişisiz qaldılar, onlar da lezbiyanlığa başladılar. Lut onlara nəsihət etsə də, qəbul etmədilər. Belə ki, Allah-Təala onlara əzab göndərib hamısını həlak etdi. Əvvəlcə səmadan daş yağıb, o əsnada yer də şiddətli zəlzələdən aralanıb hamısı yerə qərq oldular).*

**85) (وَاِلٰى مَدْيَنَ اَخَاهُمْ شُعَيْبًاۜ) – Mədyən camaatına da onların qardaşı Şüeybi peyğəmbər göndərdik. (قَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ) – Şüeyb dedi: "Ey qövm, ancaq Allah-Təalaya ibadət edin. (مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُۜ) – sizdən ötrü Allah-Təaladan başqa, haqq olan məbud yoxdur. (قَدْ جَٓاءَتْكُمْ بَيِّنَةٌ مِنْ رَبِّكُمْ) – həqiqətən, sizə Allah-Təaladan mənim haqq olmağıma açıq-aşkar olan dəlil gəldi. (فَاَوْفُوا الْكَيْلَ وَالْمِيزَانَ) – alış-verişdə ölçü və tərəzini düz edib əskik etməyin. (وَلَا تَبْخَسُوا النَّاسَ اَشْيَٓاءَهُمْ) – ölçüdə, ya da çəkidə insanların əşyalarını azaltmayın. (وَلَا تُفْسِدُوا فِي الْاَرْضِ بَعْدَ اِصْلَاحِهَا) – Allah-Təala peyğəmbər göndərib yer üzünü islah edəndən sonra siz yer üzündə fəsad törətməyin. (ذٰلِكُمْ خَيْرٌ لَكُمْ) – bu qeyd olunan hökmlər insanlıq aləmində, bir-birinizlə olan rəftarınızda, alış-verişdə sizin üçün daha yaxşıdır. (اِنْ كُنْتُمْ مُؤْمِنِينَ) – əgər mənim sözlərimi təsdiq edib Allah-Təalaya iman gətirsəniz,** (əlbəttə, mənim sözlərimi təsdiq edin, mənim sözlərim faydalı sözlərdir).

**86) (وَلَا تَقْعُدُوا بِكُلِّ صِرَاطٍ تُوعِدُونَ) – Allah-Təalanın haqq olan yollarının və hökmlərinin qarşısında oturmayın ki, xalqı qorxudub yoldan qaytarmayasınız, (وَتَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ مَنْ اٰمَنَ بِه۪) – və Allah-Təalaya iman gətirən şəxslərə iman gətirməkdə mane olmayın. (وَتَبْغُونَهَا عِوَجًاۚ) - və insanlara Allah-Təalanın yolunu pis xüsusiyyətlərlə vəsf etməyin ki, insanlar da Allah-Təalanın yolundan uzaq olmasınlar.** (Belə şər əməllərdən uzaq olun). **(وَاذْكُرُٓوا اِذْ كُنْتُمْ قَلِيلًا فَكَثَّرَكُمْۖ)** – (ey camaat), **yadınıza o zamanı salın ki, siz çox az idiniz. Allah-Təala sizə nemət verib sizi çox edib nəslinizi artırdı. (وَانْظُرُوا كَيْفَ كَانَ عَاقِبَةُ الْمُفْسِد۪ينَ) – baxıb görün ki, sizdən əvvəl fəsad törədən şəxslərin axırı necə oldu?** (Nuh, Hud və Salehin qövmləri sizdən əvvəl fəsad törətdilər. Onlara əzab nazil olduğu üçün siz onlardan ibrət götürüb Allah-Təalaya asi olmayın).

**87) (وَاِنْ كَانَ طَٓائِفَةٌ مِنْكُمْ اٰمَنُوا بِالَّذ۪يٓ اُرْسِلْتُ بِه۪) – hərçənd siz mənim haqqımda ixtilaf etdinizsə də, içinizdən bir tayfa mənim Allah-Təala tərəfindən**

وَطَائِفَةٌ لَمْ يُؤْمِنُوا فَاصْبِرُوا حَتّٰى يَحْكُمَ اللّٰهُ بَيْنَنَاۚ وَهُوَ خَيْرُ الْحَاكِمِينَ ﴿٨٧﴾ قَالَ الْمَلَأُ الَّذٖينَ اسْتَكْبَرُوا مِنْ قَوْمِهٖ لَنُخْرِجَنَّكَ يَا شُعَيْبُ وَالَّذٖينَ اٰمَنُوا مَعَكَ مِنْ قَرْيَتِنَٓا اَوْ لَتَعُودُنَّ فٖي مِلَّتِنَاۜ قَالَ اَوَلَوْ كُنَّا كَارِهٖينَ ﴿٨٨﴾ قَدِ افْتَرَيْنَا عَلَى اللّٰهِ كَذِبًا اِنْ عُدْنَا فٖي مِلَّتِكُمْ بَعْدَ اِذْ نَجّٰينَا اللّٰهُ مِنْهَاۜ وَمَا يَكُونُ لَنَٓا اَنْ نَعُودَ فٖيهَٓا اِلَّٓا اَنْ يَشَٓاءَ اللّٰهُ رَبُّنَاۜ وَسِعَ رَبُّنَا كُلَّ شَيْءٍ عِلْمًاۜ عَلَى اللّٰهِ تَوَكَّلْنَاۜ رَبَّنَا افْتَحْ بَيْنَنَا وَبَيْنَ قَوْمِنَا بِالْحَقِّ وَاَنْتَ خَيْرُ الْفَاتِحٖينَ ﴿٨٩﴾ وَقَالَ الْمَلَأُ الَّذٖينَ كَفَرُوا مِنْ قَوْمِهٖ

---

**o hökmləri yetirmək üçün göndərildiyimə iman gətirdi. (وَطَائِفَةٌ لَمْ يُؤْمِنُوا) – amma digər bir tayfa iman gətirmədi. (فَاصْبِرُوا حَتّٰى يَحْكُمَ اللّٰهُ بَيْنَنَاۚ) – səbir edin ki, Allah-Təala da bizim aramızda hökm edib haqla batili bir-birindən ayırsın. (وَهُوَ خَيْرُ الْحَاكِمِينَ) – hökm edənlərin yaxşısı Allah-Təaladır".**

**88) (قَالَ الْمَلَأُ الَّذٖينَ اسْتَكْبَرُوا مِنْ قَوْمِهٖ) – Şüeybın qövmündən böyük və təkəbbürlü olan şəxslər Şüeybə cavab verib dedilər: "(لَنُخْرِجَنَّكَ يَا شُعَيْبُ وَالَّذٖينَ اٰمَنُوا مَعَكَ مِنْ قَرْيَتِنَٓا) – Ey Şüeyb, əlbəttə, səni və səninlə birlikdə iman gətirənləri öz ölkəmizdən çıxaracağıq. Çünki sən başqa bir din gətiribsən. (اَوْ لَتَعُودُنَّ فٖي مِلَّتِنَاۜ) – ya da qayıdıb yenidən bizim dinimizə daxil olsanız, o vaxt da biz sizinlə qardaş olub, heç bir əziyyət və azar bizdən sizə yetişməz". (قَالَ اَوَلَوْ كُنَّا كَارِهٖينَ) – Şüeyb dedi: "Bəs biz sizin dininizə qayıdaq? Hərçənd bizi zorla qayıtmağa vadar etsəniz də, sizin dininizə daxil olmamız mümkün deyil".**

**89) (قَدِ افْتَرَيْنَا عَلَى اللّٰهِ كَذِبًا اِنْ عُدْنَا فٖي مِلَّتِكُمْ بَعْدَ اِذْ نَجّٰينَا اللّٰهُ مِنْهَاۜ) – Allah-Təala bizi sizdən xilas edəndən sonra əgər sizin dininizə qayıtsaq, o vaxt Allah-Təalaya iftira edib, sizə dediyimiz hökmləri Allah-Təalaya yalandan isnad etmiş olarıq. ( وَمَا يَكُونُ لَنَٓا اَنْ نَعُودَ فٖيهَٓا اِلَّٓا اَنْ يَشَٓاءَ اللّٰهُ رَبُّنَاۜ) – bizdən ötrü caiz deyil ki, sizin dininizə qayıdaq. Ancaq bizə tərbiyə verən rəbb Allah-Təala özü qayıtmağımızı istəsə, o vaxt da qayıdarıq. Allah-Təala da əlbəttə, küfrə qayıtmağımıza razı olmaz. Buna görə də sizin dininizə dönməmiz imkansızdır. (وَسِعَ رَبُّنَا كُلَّ شَيْءٍ عِلْمًاۜ) – bizim rəbbimiz Allah-Təala hər bir şeyi elmlə əhatə edəndir. Hər bir şey Allah-Təalaya məlumdur. Allah-Təala imandan sonra küfrə qayıtmağın qəbih olduğundan agahdır, necə ola bilər ki, bizi təkrar sizin dininizə qaytarsın? (عَلَى اللّٰهِ تَوَكَّلْنَاۜ)– Allah-Təalaya təvəkkül etmişik ki, bizi imanımızda möhkəm edib nifaqdan saxlasın, (ondan sonra Hz. Şüeyb qövmünün sözlərindən sıxılıb, dua etməyə başladı:) (رَبَّنَا افْتَحْ بَيْنَنَا وَبَيْنَ قَوْمِنَا بِالْحَقِّ) – ey bizim rəbbimiz, bizimlə qövmümüz arasında haqq və ədalətlə hökm et. Bunlar imana gələn deyillər. (وَاَنْتَ خَيْرُ الْفَاتِحٖينَ) – hökm edənlərin yaxşısı sənsən".**

**90) (وَقَالَ الْمَلَأُ الَّذٖينَ كَفَرُوا مِنْ قَوْمِهٖ) – Şüeybin qövmündən kafir olan böyüklər və rəislər Şüeybə cavab verməyib öz camaatlarına xitab edib dedilər:**

لَئِنِ اتَّبَعْتُمْ شُعَيْبًا اِنَّكُمْ اِذًا لَخَاسِرُونَ ﴿٩٠﴾ فَاَخَذَتْهُمُ الرَّجْفَةُ فَاَصْبَحُوا فٖي دَارِهِمْ جَاثِمٖينَ ﴿٩١﴾
اَلَّذٖينَ كَذَّبُوا شُعَيْبًا كَاَنْ لَمْ يَغْنَوْا فٖيهَا اَلَّذٖينَ كَذَّبُوا شُعَيْبًا كَانُوا هُمُ الْخَاسِرٖينَ ﴿٩٢﴾ فَتَوَلّٰى عَنْهُمْ
وَقَالَ يَا قَوْمِ لَقَدْ اَبْلَغْتُكُمْ رِسَالَاتِ رَبّٖي وَنَصَحْتُ لَكُمْ فَكَيْفَ اٰسٰى عَلٰى قَوْمٍ كَافِرٖينَ﴿٩٣﴾ وَمَٓا
اَرْسَلْنَا فٖي قَرْيَةٍ مِنْ نَبِيٍّ اِلَّا اَخَذْنَٓا اَهْلَهَا بِالْبَاْسَٓاءِ وَالضَّرَّٓاءِ

---

(لَئِنِ اتَّبَعْتُمْ شُعَيْبًا اِنَّكُمْ اِذًا لَخَاسِرُونَ) – **“Əgər Şüeybə tabe olub iman gətirməkdə davam etsəniz, əlbəttə, həqiqətən, o vaxt özünüzə zərər vermiş olarsınız,** (çünki Şüeyb zəlalətdədir ona tabe olmağın faydası olmaz)**”.**

**91) (فَاَخَذَتْهُمُ الرَّجْفَةُ) – elə ki Şüeybin qövmü küfrlərində israr etdilər, onlara əzab nazil oldu, şiddətli səslə gələn zəlzələ onları yaxalayıb, (فَاَصْبَحُوا فٖي دَارِهِمْ جَاثِمٖينَ) – sağ-salamat öz mənzillərində oturduqları halda, dizləri üstə çöküb həlak oldular.**

**92) (اَلَّذٖينَ كَذَّبُوا شُعَيْبًا كَاَنْ لَمْ يَغْنَوْا فٖيهَا) – Şüeybi təkzib edən o şəxslər, sanki, öz yurdlarında heç olmayıb, güzəran keçirməmiş kimi həlak olub, onlardan bir iz qalmadı, (اَلَّذٖينَ كَذَّبُوا شُعَيْبًا كَانُوا هُمُ الْخَاسِرٖينَ) – Şüeybi təkzib edən o şəxslər özlərinə zərər vermiş oldular. O təkzib etməyin əvəzinə onlara əzab nazil oldu.**

**93) (فَتَوَلّٰى عَنْهُمْ) – elə ki əzab nazil oldu, * Şüeyb onların arasından çıxıb, onlardan üz döndərib, (وَقَالَ يَا قَوْمِ لَقَدْ اَبْلَغْتُكُمْ رِسَالَاتِ رَبّٖي ) – təəssüflə dedi: “Ey qövm, həqiqətən, sizə öz rəbbimin hökmlərini yetirdim. (وَنَصَحْتُ لَكُمْ) – və sizə nəsihət etdim, gəlin Allah-Təalaya itaət edin, mənim sözümə və nəsihətimə qulaq asın, (bu sözləri qövmünə təəssüflə, onlardan ötrü məhzun və qəmgin olduğu üçün dedi. Ondan sonra agah oldu ki, qövmü Allaha itaəti tərk edib, əzaba layiq olubdur. Belə şəxslərə görə qəmgin olmaq layiq deyil. Öz-özünə dedi: (فَكَيْفَ اٰسٰى عَلٰى قَوْمٍ كَافِرٖينَ) – bir qövm ki Allah-Təalanı inkar edib, mən onlara görə necə məhzun və qəmgin olaram? Belə qövmə görə qəmgin olmaq layiq deyildir.**

*(*Qeyd: Şüeybin adı Tövratda Yəşrudur. Şüeyb ibn Mikil ibn Yəşcur (Təbərsi, Məcməul-Bəyan, IV/688) ibn Mədyən ibn İbrahimdir. Mədyən məmləkəti Fələstindədir, Mədyən ibn İbrahimin adıyla adlanıbdır. Allah-Təala Şüeybi o camaata peyğəmbər göndərdi. O camaatın əməli bütpərəstlik, ölçüdə və tərəzidə xəyanət etmək və artıq alıb, əskik satmaq idi. Şüeyb nəsihət və vəz edib, onları Allah-Təala tərəfinə dəvət etdi. İtaət etmədilər. Axırda Allah-Təala zəlzələ ilə onları həlak etdi. Bir də Allah-Təala Şüeybi iki camaata peyğəmbər göndəribdir. Onun qissəsi 26-cı Şüəra surəsində qeyd olunubdur).*

**94) (وَمَٓا اَرْسَلْنَا فٖي قَرْيَةٍ مِنْ نَبِيٍّ اِلَّا اَخَذْنَٓا اَهْلَهَا بِالْبَاْسَٓاءِ وَالضَّرَّٓاءِ) – biz hansı ölkəyə bir peyğəmbər göndərdiksə, oranın əhalisi iman etmədiyi üçün yoxsulluq və**

لَعَلَّهُمْ يَضَّرَّعُونَ ﴿٩٤﴾ ثُمَّ بَدَّلْنَا مَكَانَ السَّيِّئَةِ الْحَسَنَةَ حَتّٰى عَفَوْا وَقَالُوا قَدْ مَسَّ اٰبَاۤءَنَا الضَّرَّاۤءُ وَالسَّرَّاۤءُ فَاَخَذْنَاهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ ﴿٩٥﴾ وَلَوْ اَنَّ اَهْلَ الْقُرٰى اٰمَنُوا وَاتَّقَوْا لَفَتَحْنَا عَلَيْهِمْ بَرَكَاتٍ مِنَ السَّمَاۤءِ وَالْاَرْضِ وَلٰكِنْ كَذَّبُوا فَاَخَذْنَاهُمْ بِمَا كَانُوا يَكْسِبُونَ ﴿٩٦﴾ اَفَاَمِنَ اَهْلُ الْقُرٰى اَنْ يَاْتِيَهُمْ بَاْسُنَا بَيَاتًا وَهُمْ نَآئِمُونَ ﴿٩٧﴾ اَوَاَمِنَ اَهْلُ الْقُرٰى اَنْ يَاْتِيَهُمْ بَاْسُنَا ضُحًى وَهُمْ يَلْعَبُونَ ﴿٩٨﴾

---

**xəstəliyə düçar etdik ki, (لَعَلَّهُمْ يَضَّرَّعُونَ) – bəlkə yalvarıb-yaxarıb, təkəbbür və qürurdan uzaq olub, tövbə edib, iman gətirsinlər.**

**95) (ثُمَّ بَدَّلْنَا مَكَانَ السَّيِّئَةِ الْحَسَنَةَ) – onlar yoxsulluq və xəstəlik səbəbinə təkəbbürdən vaz keçib iman etmədikləri üçün ondan sonra yoxsulluq və xəstəliyin əvəzinə onlara bol nemət və sağlamlıq bəxş etdik ki, bəlkə, o səbəbə iman gətirsinlər. (حَتّٰى عَفَوْا) – onlara o qədər nemət və sağlamlıq verdik ki, özləri və malları son dərəcə artdı. (وَقَالُوا قَدْ مَسَّ اٰبَاۤءَنَا الضَّرَّاۤءُ وَالسَّرَّاۤءُ) – dedilər: "Zəmanənin adətidir," ata-babalarımıza da xəstəlik və yoxsulluq üz vermişdi. İndi isə bizə nemət və firavanlıq gəlib. Zəmanənin adətidir, bəzən yoxsulluq və xəstəlik, bəzən də nemət və sağlamlıq olar, bunun Allah-Təalaya dəxli yoxdur". (فَاَخَذْنَاهُمْ بَغْتَةً وَهُمْ لَا يَشْعُرُونَ) – təkəbbür və qürurları son həddinə çatıb, istirahət vaxtlarında qəflətən bixəbər olduqları halda onlara əzab göndərib hamısını həlak etdik. Heç agah deyildilər ki, onlara əzab gələcəkdir.**

**96) (وَلَوْ اَنَّ اَهْلَ الْقُرٰى اٰمَنُوا وَاتَّقَوْا) – peyğəmbər göndərdiyimiz ölkələrin əhalisi, əgər Allah-Təaladan qorxub iman gətirsəydi, (لَفَتَحْنَا عَلَيْهِمْ بَرَكَاتٍ مِنَ السَّمَاۤءِ وَالْاَرْضِ) – hər halda o əzabın əvəzinə səmaların və yerin bərəkətini onların üzünə açıb səmadan yağış və yerdən hər cür meyvələri və ruziləri onlara bəxş edərdik. (وَلٰكِنْ كَذَّبُوا) – lakin peyğəmbərləri təkzib etdilər. (فَاَخَذْنَاهُمْ بِمَا كَانُوا يَكْسِبُونَ) – qazandıqları əməllərinə görə də onlara əzab etdik.**

**97) (اَفَاَمِنَ اَهْلُ الْقُرٰى) – yoxsa o ölkələrin və şəhərlərin əhalisi bundan xatircəm idilər ki, (اَنْ يَاْتِيَهُمْ بَاْسُنَا بَيَاتًا وَهُمْ نَآئِمُونَ) – bizim əzabımız gecə yatdıqları halda onlara gəlməz? ***

*(***Qeyd:** *İlahi, sənin əzabından necə xatircəm olmaq olar? H. 1296-cı ildə mən həqir kitab müəllifi Ərdəbil şəhərində idim. Əcəm bayramı Novruzda gecənin qaranlığında saat 2 ilə 3 arasında şiddətli bir zəlzələ vaqe oldu. Heç bir nəfərdə də həyat ümidi yox idi. O zəlzələnin sarsıntısı 25 gün davam etdi).*

**98) (اَوَاَمِنَ اَهْلُ الْقُرٰى) – yoxsa o ölkələrin və şəhərlərin əhalisi bundan xatircəm idilər ki, (اَنْ يَاْتِيَهُمْ بَاْسُنَا ضُحًى وَهُمْ يَلْعَبُونَ) – bizim əzabımız gündüz vaxtı dünya əyləncəsi ilə məşğul olduqları halda onlara gəlməz?** (Axirət əməlinin müqabilində dünya əməli oyun, əyləncə hesab olunur)**.***

اَفَاَمِنُوا مَكْرَ اللّٰهِۚ فَلَا يَاْمَنُ مَكْرَ اللّٰهِ اِلَّا الْقَوْمُ الْخَاسِرُونَ ﴿٩٩﴾ اَوَلَمْ يَهْدِ لِلَّذٖينَ يَرِثُونَ الْاَرْضَ
مِنْ بَعْدِ اَهْلِهَٓا اَنْ لَوْ نَشَٓاءُ اَصَبْنَاهُمْ بِذُنُوبِهِمْۚ وَنَطْبَعُ عَلٰى قُلُوبِهِمْ فَهُمْ لَا يَسْمَعُونَ﴿١٠٠﴾ تِلْكَ
الْقُرٰى نَقُصُّ عَلَيْكَ مِنْ اَنْبَٓائِهَاۚ وَلَقَدْ جَٓاءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِۚ فَمَا كَانُوا لِيُؤْمِنُوا بِمَا كَذَّبُوا مِنْ
قَبْلُۜ كَذٰلِكَ يَطْبَعُ اللّٰهُ عَلٰى قُلُوبِ الْكَافِرٖينَ﴿١٠١﴾ وَمَا وَجَدْنَا لِاَكْثَرِهِمْ مِنْ عَهْدٍۚ وَاِنْ وَجَدْنَٓا
اَكْثَرَهُمْ لَفَاسِقٖينَ ﴿١٠٢﴾

---

*(***Qeyd:** İlahi, necə xatircəm olmaq olar? H.1318-ci ildə zülqədə ayının 4-də zöhrdən bir saat sonra zəlzələ vaqe oldu, Şamaxı şəhəri birdəfəlik xarab olub Bakı şəhərində də zəlzələnin şiddətindən insanların həyata ümidləri kəsilib, az qala məhv olmuşdular).*

**99) (اَفَاَمِنُوا مَكْرَ اللّٰهِۚ) – yoxsa onlar Allah-Təalanın onları qəflətən yaxalayıb, əzab etməsindən xatircəm idilər? (فَلَا يَاْمَنُ مَكْرَ اللّٰهِ اِلَّا الْقَوْمُ الْخَاسِرُونَ) – özlərinə zərər edənlərdən başqası Allah-Təalanın onları qəflətən yaxalayıb, əzab etməsindən xatircəm olmaz.**

**100) (اَوَلَمْ يَهْدِ لِلَّذٖينَ يَرِثُونَ الْاَرْضَ مِنْ بَعْدِ اَهْلِهَٓا ) – o şəxslər ki bir yerin əhalisi həlak olandan sonra oraya varis olur, bəs əvvəlki şəxslərin həlak olması və bunların onlara varis olması onlardan ötrü hidayət olub, izhar etmədi ki, (اَنْ لَوْ نَشَٓاءُ اَصَبْنَاهُمْ بِذُنُوبِهِمْۚ) – əgər biz istəsək, əvvəlkilərə əzab göndərib həlak etdiyimiz kimi, onlara da əzab göndərib həlak edərdik. (وَنَطْبَعُ عَلٰى قُلُوبِهِمْ) – onların qəlblərinə öz əməlləri səbəbi ilə elə bir möhür vurardıq ki, (فَهُمْ لَا يَسْمَعُونَ) – bir də heç vaxt öyüd-nəsihət eşidib qəbul edə bilməzdilər.**

**101) (تِلْكَ الْقُرٰى نَقُصُّ عَلَيْكَ مِنْ اَنْبَٓائِهَاۚ)** – (ey Məhəmməd)**, o ölkələrin bəzi xəbərlərini səndən ötrü qeyd edirik, bunlardan savayı o ölkələrin başqa xəbərləri də var ki, qeyd etməmişik. (وَلَقَدْ جَٓاءَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِۚ) – həqiqətən, onlara bizim peyğəmbərlərimiz aşkar olan möcüzələrlə gəldilər. (فَمَا كَانُوا لِيُؤْمِنُوا بِمَا كَذَّبُوا مِنْ قَبْلُ) - peyğəmbərlər gəlib təbliğ edəndən sonra da öncədən təkzib etdiklərinə iman gətirmədilər.** (Peyğəmbərlərdən əvvəl Allah-Təalanın itaətindən çıxıb, bütlərə sitayiş edib haram əməllərə qoşulduqları kimi, peyğəmbərlər gələndən sonra da o əməllərə davam edib peyğəmbərlərə iman gətirmədilər). (كَذٰلِكَ يَطْبَعُ اللّٰهُ عَلٰى قُلُوبِ الْكَافِرٖينَ) – **Allah-Təala kafirlərin qəlblərinə belə möhür vurar, onlardan iman və xeyir əməl meydana gəlməz.**

**102) (وَمَا وَجَدْنَا لِاَكْثَرِهِمْ مِنْ عَهْدٍۚ) – insanların əksəriyyətini Allah-Təala ilə olan əhddə möhkəm olub iman və təqvadan yapışan görmədik. (وَاِنْ وَجَدْنَٓا اَكْثَرَهُمْ لَفَاسِقٖينَ) – lakin onların çoxunun fasiq, əhdi pozan və imanında möhkəm olmayan olaraq gördük.** (İlahi, bizim zahirdə müsəlman, əslində isə Quran əhli olmadığımızı görüb, bu kəlamla bizə xitab edirsiniz?)

ثُمَّ بَعَثْنَا مِنْ بَعْدِهِمْ مُوسٰى بِاٰيَاتِنَآ اِلٰى فِرْعَوْنَ وَمَلَائِهٖ فَظَلَمُوا بِهَاۚ فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُفْسِدِينَ
﴿١٠٣﴾ وَقَالَ مُوسٰى يَا فِرْعَوْنُ اِنِّي رَسُولٌ مِنْ رَبِّ الْعَالَمِينَۙ ﴿١٠٤﴾ حَقِيقٌ عَلٰٓى اَنْ لَا اَقُولَ عَلَى
اللّٰهِ اِلَّا الْحَقَّۜ قَدْ جِئْتُكُمْ بِبَيِّنَةٍ مِنْ رَبِّكُمْ فَاَرْسِلْ مَعِيَ بَنِيٓ اِسْرَٓائِيلَۜ ﴿١٠٥﴾ قَالَ اِنْ كُنْتَ جِئْتَ بِاٰيَةٍ فَاْتِ
بِهَآ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ﴿١٠٦﴾ فَاَلْقٰى عَصَاهُ فَاِذَا هِيَ ثُعْبَانٌ مُبِينٌۚ ﴿١٠٧﴾

---

**103) (** ثُمَّ بَعَثْنَا مِنْ بَعْدِهِمْ مُوسٰى بِاٰيَاتِنَآ اِلٰى فِرْعَوْنَ وَمَلَائِهٖ **) – əvvəlki peyğəmbərlərdən sonra Musanı bizim möcüzələrimizlə* Misir padşahı firona və onun ətrafında olan böyük şəxslərə peyğəmbər göndərdik. (**فَظَلَمُوا بِهَاۚ**) – zülm edib Musaya verdiyimiz möcüzələrimizi inkar etdilər. (**فَانْظُرْ كَيْفَ كَانَ عَاقِبَةُ الْمُفْسِدِينَ**) – ey Məhəmməd, bax gör ki, bu fəsad törədən fironun və ona tabe olanların axırı necə oldu və onlara necə əzab göndərib hamısını həlak etdim.**

*(***Qeyd:** Misir padşahlarına ərəblər firon deyir. Necə ki fars padşahına kisra, yunan padşahına qeysər, həbəş padşahına nəcaşi, Çin padşahına xaqan deyilir).*

**104) (**وَقَالَ مُوسٰى يَا فِرْعَوْنُ**) – Musa dedi: "Ey firon, (**اِنِّي رَسُولٌ مِنْ رَبِّ الْعَالَمِينَ**) – həqiqətən, mən sizə aləmlərə tərbiyə verən rəbb Allah-Təala tərəfindən peyğəmbərəm.**

**105) (**حَقِيقٌ عَلٰٓى اَنْ لَا اَقُولَ عَلَى اللّٰهِ اِلَّا الْحَقَّ**) – mənə layiq olan Allah-Təalaya ancaq haqq olan sözü isnad etməkdir, haqdan başqa söz demək mənə layiq deyildir.** (Elə ki Hz. Musa – mən Allah-Təala tərəfindən peyğəmbərəm, dedi, firon belə söylədi: "Yalan deyirsən". O səbəbdən də ona cavab olaraq Hz. Musa bu kəlamı buyurdu:) **(**قَدْ جِئْتُكُمْ بِبَيِّنَةٍ مِنْ رَبِّكُمْ**) – həqiqətən, sizə rəbbiniz Allah-Təaladan dəlil və sübutla peyğəmbər gəlmişəm. (**فَاَرْسِلْ مَعِيَ بَنِيٓ اِسْرَٓائِيلَ**) – bəni-İsraildən əl çəkib onları mənə həvalə et ki, onları öz müqəddəs məkanlarına - babaları olan Hz. İbrahimin məqamına aparım".** (Yusif Misirdə rəhmətə gedəndən sonra Misirdə olan hər firon bəni-İsraili özlərinə qul hesab edib, onları son dərəcə məşəqqətli əməllərə vadar edirdilər. O səbəbdən Hz. Musa firona dedi ki, bəni-İsraildən əl çəkib, onları mənə həvalə et)**.**

**106) (**قَالَ اِنْ كُنْتَ جِئْتَ بِاٰيَةٍ فَاْتِ بِهَآ اِنْ كُنْتَ مِنَ الصَّادِقِينَ**) - firon dedi: "Ey Musa, əgər mən peyğəmbərəm sözünü doğru deyirsənsə və əgər peyğəmbər olmağına bir dəlil gətiribsənsə, o dəlili gətir".**

**107) (**فَاَلْقٰى عَصَاهُ**) – (elə ki firon - əgər möcüzə varındırsa, gətir, dedi), Hz. Musa əlində olan əsanı yerə atdı. (**فَاِذَا هِيَ ثُعْبَانٌ مُبِينٌ**) – qəfildən baxıb gördülər ki, əsa açıq-aşkar bir əjdəha oldu, onun əjdəha olmasına heç bir şəkk və şübhə olmadı.** (Elə ki əsa əjdəha oldu, xalq qorxudan tamam dağıldı, firon taxtından düşüb qaçdı, fəryad edib dedi: "Ey Musa, əjdəhanı tut, mən

وَنَزَعَ يَدَهُ فَاِذَا هِيَ بَيْضَٓاءُ لِلنَّاظِرِينَ ﴿١٠٨﴾ قَالَ الْمَلَأُ مِنْ قَوْمِ فِرْعَوْنَ اِنَّ هٰذَا لَسَاحِرٌ عَلِيمٌ
﴿١٠٩﴾ يُرِيدُ اَنْ يُخْرِجَكُمْ مِنْ اَرْضِكُمْ فَمَاذَا تَاْمُرُونَ ﴿١١٠﴾ قَالُوٓا اَرْجِهْ وَاَخَاهُ وَاَرْسِلْ فِي
الْمَدَٓائِنِ حَاشِرِينَ ﴿١١١﴾ يَاْتُوكَ بِكُلِّ سَاحِرٍ عَلِيمٍ ﴿١١٢﴾ وَجَٓاءَ السَّحَرَةُ فِرْعَوْنَ قَالُوٓا اِنَّ لَنَا
لَاَجْرًا اِنْ كُنَّا نَحْنُ الْغَالِبِينَ ﴿١١٣﴾ قَالَ نَعَمْ وَاِنَّكُمْ لَمِنَ الْمُقَرَّبِينَ ﴿١١٤﴾

---

sənə iman gətirib, bəni-İsraildən əl çəkərəm''. Hz. Musa əjdəhanı tutub, o da dərhal əsa oldu, ondan sonra Hz. Musa dedi: "Başqa bir möcüzə də varımdır'').

**108) (وَنَزَعَ يَدَهُ) – Hz. Musa əlini qoltuğuna salıb ondan sonra əlini qoltuğundan çıxartdı. (فَاِذَا هِيَ بَيْضَٓاءُ لِلنَّاظِرِينَ) – Musanın əli baxanlardan ötrü qəfildən ağ və şimşək kimi işıqlı oldu, çox təəccüblü olduğuna görə bütün xalq onun əlinin tamaşasına yığıldı.** (Bu zəmanədə elm gücü ilə yaranan elektrik işığı əgər o dövrdə meydana gəlmiş olsaydı, Hz. Musadan ötrü ağ əl daha böyük möcüzə sayılardı).

**109) (قَالَ الْمَلَأُ مِنْ قَوْمِ فِرْعَوْنَ) – fironun qövmündən olan böyük şəxslər dedilər: (اِنَّ هٰذَا لَسَاحِرٌ عَلِيمٌ) – "Həqiqətən, bu Musa, əlbəttə, bilikli bir sehrbazdır. Sehr elmində çox məharəti vardır.**

**110) ( يُرِيدُ اَنْ يُخْرِجَكُمْ مِنْ اَرْضِكُمْ) – Musanın istəyi odur ki, sizi Misirdən çıxarıb özü hakim olsun. (فَمَاذَا تَاْمُرُونَ) – bundan ötrü nə məsləhət görürsünüz? Bu barədə rəyiniz nədir?"**

**111) (قَالُوٓا اَرْجِهْ وَاَخَاهُ)** – (vəzirlər məşvərət edib firona) **dedilər: "Musanın və qardaşı Harunun işini bir qədər təxirə salıb, (وَاَرْسِلْ فِي الْمَدَٓائِنِ حَاشِرِينَ) – şəhərlərə sehrbazları yığan adamlar göndər.**

**112) (يَاْتُوكَ بِكُلِّ سَاحِرٍ عَلِيمٍ) – qoy sənin hüzuruna bütün bilikli sehrbazları gətirsinlər, əgər Musa onlara qalib olsa, məlum olar ki, Musa haqlıdır, amma əgər sehrbazlar qalib olsa, Musanın batil olması məlum olar. O vaxt da ona cəzasını verərsən.** (Ondan sonra firon şəhərlərdəki bütün sehrbazları toplayıb hazır etdi).

**113) (وَجَٓاءَ السَّحَرَةُ فِرْعَوْنَ) – sehrbazlar gəlib fironun yanında hazır oldular. (قَالُوٓا اِنَّ لَنَا لَاَجْرًا اِنْ كُنَّا نَحْنُ الْغَالِبِينَ) – sehrbazlar firona dedilər: əgər həqiqətən, biz Musaya qalib olsaq, bizdən ötrü gərək böyük əcr, mükafat olsun".**

**114) (قَالَ نَعَمْ وَاِنَّكُمْ لَمِنَ الْمُقَرَّبِينَ) – firon dedi: "Əlbəttə, sizdən ötrü böyük əcr və mükafat olacaqdır. Amma ondan başqa həqiqətən, siz, əlbəttə, mənə yaxın olan şəxslərdən olub, mənim hüzuruma ilk girib ən son çıxanlardan olacaqsınız.** (Hz. Musaya xəbər verdilər ki, hazır ol, əgər bu sehrbazlara qalib olsan, o vaxt sənin haqq olmağın məlum olar. Hz. Musa da, sehrbazlar da hazır oldular. Sehrlə hazırladıqları şeyləri də gətirdilər).

قَالُوا يَا مُوسٰى اِمَّٓا اَنْ تُلْقِيَ وَاِمَّٓا اَنْ نَكُونَ نَحْنُ الْمُلْقِينَ ﴿١١٥﴾ قَالَ اَلْقُواۚ فَلَمَّٓا اَلْقَوْا سَحَرُوٓا اَعْيُنَ
النَّاسِ وَاسْتَرْهَبُوهُمْ وَجَٓاؤُ بِسِحْرٍ عَظِيمٍ﴿١١٦﴾ وَاَوْحَيْنَٓا اِلٰى مُوسٰى اَنْ اَلْقِ عَصَاكَۚ فَاِذَا هِيَ تَلْقَفُ
مَا يَاْفِكُونَۚ ﴿١١٧﴾ فَوَقَعَ الْحَقُّ وَبَطَلَ مَا كَانُوا يَعْمَلُونَۚ ﴿١١٨﴾ فَغُلِبُوا هُنَالِكَ وَانْقَلَبُوا صَاغِرِينَۚ
﴿١١٩﴾ وَاُلْقِيَ السَّحَرَةُ سَاجِدِينَۚ ﴿١٢٠﴾ قَالُوٓا اٰمَنَّا بِرَبِّ الْعَالَمِينَۙ ﴿١٢١﴾ رَبِّ مُوسٰى وَهٰرُونَ
﴿١٢٢﴾ قَالَ فِرْعَوْنُ اٰمَنْتُمْ بِهٖ قَبْلَ اَنْ اٰذَنَ لَكُمْۚ اِنَّ هٰذَا لَمَكْرٌ مَكَرْتُمُوهُ فِي الْمَدِينَةِ لِتُخْرِجُوا مِنْهَٓا اَهْلَهَاۚ

---

**115)** (قَالُوا يَا مُوسٰى اِمَّٓا اَنْ تُلْقِيَ) – (sehrbazlar ədəbə riayət edib) **dedilər: "Ey Musa, əvvəlcə ya sən əsanı at,** (وَاِمَّٓا اَنْ نَكُونَ نَحْنُ الْمُلْقِينَ) – **ya da ilk biz şeylərimizi ataq. İxtiyar səndədir".**

**116)** (قَالَ اَلْقُواۚ) – (Hz. Musa onların ədəbinə görə onları qabağa salıb) **dedi: "Əvvəlcə siz atın". (Onların ipdən, ağacdan bəzi alətləri var idi. Hamısını meydanın ortasına atdılar. O şeylər tamamən ilan, şir, pələng surətində zahir oldular.** (فَلَمَّٓا اَلْقَوْا) – **o zaman ki sehrbazlar o şeyləri atdılar,** (سَحَرُوٓا اَعْيُنَ النَّاسِ) – **xalqın gözlərini sehrləyib, hiylə ilə o şeylərin həqiqi olduğuna inandırdılar.** (وَاسْتَرْهَبُوهُمْ) – **və xalqı son dərəcə qorxuya saldılar,** (وَجَٓاؤُ بِسِحْرٍ عَظِيمٍ) – **çox böyük bir sehr gətirdilər.**

**117)** (وَاَوْحَيْنَٓا اِلٰى مُوسٰى اَنْ اَلْقِ عَصَاكَ) – **biz vəhy edib Musaya dedik: "Ey Musa, əlindəki əsanı yerə at".** (Hz. Musa Allah-Təalanın əmri ilə əsanı əlindən yerə atdı). (فَاِذَا هِيَ تَلْقَفُ مَا يَاْفِكُونَ) – **əsa son dərəcə əzəmətli əjdəha olub onların yalandan düzəltdikləri şeylərini tamamən uddu.**

**118)** (فَوَقَعَ الْحَقُّ) – **haqq öz yerində sabit olub vaqe oldu.** (وَبَطَلَ مَا كَانُوا يَعْمَلُونَ) – **sehrbazların düzəltdiyi əməllərin hamısı batil oldu.**

**119)** (فَغُلِبُوا هُنَالِكَ) – **və o zaman sehrləri batil olduğu üçün firon, ona tabe olanlar və sehrbazlar məğlub oldular.** (وَانْقَلَبُوا صَاغِرِينَ) – **son dərəcə zəlil və həqir olduqları halda Musanın qarşısından çəkilib qayıtdılar.**

**120)** (وَاُلْقِيَ السَّحَرَةُ سَاجِدِينَ) – **elə ki sehrbazlar məğlub olub onlara Musanın haqq olması məlum oldu, hamısı üzü üstə Allah-Təaladan ötrü səcdəyə düşüb.**

**121)** (قَالُوٓا اٰمَنَّا بِرَبِّ الْعَالَمِينَ) – **dedilər: "Bütün aləmlərə tərbiyə verən rəbb Allah-Təalaya iman gətirdik,**

**122)** (رَبِّ مُوسٰى وَهٰرُونَ) – **o Allah-Təala ki, Musa və Harun ona itaət edib sitayiş edirlər".**

**123)** (قَالَ فِرْعَوْنُ اٰمَنْتُمْ بِهٖ قَبْلَ اَنْ اٰذَنَ لَكُمْۚ) – **firon sehrbazlara dedi: "Mən sizə izin vermədən əvvəl Musaya iman gətirdiniz?"** (اِنَّ هٰذَا لَمَكْرٌ مَكَرْتُمُوهُ فِي الْمَدِينَةِ لِتُخْرِجُوا مِنْهَٓا اَهْلَهَاۚ) **və hiylədir. Musa ilə birlikdə şəhərdə çölə çıxmadan**

فَسَوْفَ تَعْلَمُونَ ﴿١٢٣﴾ لَاُقَطِّعَنَّ اَيْدِيَكُمْ وَاَرْجُلَكُمْ مِنْ خِلَافٍ ثُمَّ لَاُصَلِّبَنَّكُمْ اَجْمَعِينَ ﴿١٢٤﴾
قَالُوٓا اِنَّٓا اِلٰى رَبِّنَا مُنْقَلِبُونَ ﴿١٢٥﴾ وَمَا تَنْقِمُ مِنَّٓا اِلَّٓا اَنْ اٰمَنَّا بِاٰيَاتِ رَبِّنَا لَمَّا جَٓاءَتْنَا رَبَّنَٓا اَفْرِغْ عَلَيْنَا
صَبْرًا وَتَوَفَّنَا مُسْلِمِينَ ﴿١٢٦﴾ وَقَالَ الْمَلَاُ مِنْ قَوْمِ فِرْعَوْنَ اَتَذَرُ مُوسٰى وَقَوْمَهُ لِيُفْسِدُوا فِي الْاَرْضِ
وَيَذَرَكَ وَاٰلِهَتَكَ قَالَ سَنُقَتِّلُ اَبْنَٓاءَهُمْ وَنَسْتَحْيِي نِسَٓاءَهُمْ وَاِنَّا فَوْقَهُمْ قَاهِرُونَ ﴿١٢٧﴾

---

**qabaq bu məkr bu, hiyləni qurubsunuz ki,** (Musa ilə sehrbazların əməlləri fironun əmri ilə çöldə vaqe oldu) – **siz ona iman gətirib bir-birinizə kömək olub Misir əhlini** (qibtiləri) **Misirdən çıxarıb özünüz sakin olasınız. (فَسَوْفَ تَعْلَمُونَ) – bu iman gətirmək məkr) – tezliklə biləcəksiniz ki, sizə necə əzab edəcəyəm?**

**124) (لَاُقَطِّعَنَّ اَيْدِيَكُمْ وَاَرْجُلَكُمْ مِنْ خِلَافٍ) – əlbəttə, sizin əllərinizi və ayaqlarınızı çarpaz (birini sağdan, o birini soldan) kəsdirəcəyəm. (ثُمَّ لَاُصَلِّبَنَّكُمْ اَجْمَعِينَ) – ondan sonra hamınızı asıb həlak edəcəm”.** (Dünyada insanların əl-ayağını çarpaz kəsdirib, dar ağacından ilk asdıran şəxs həmin firon idi).

**125) (قَالُوٓا اِنَّٓا اِلٰى رَبِّنَا مُنْقَلِبُونَ) – sehrbazlar dedilər: “Bizim ölməkdən qorxumuz yoxdur, əgər sən bizi qətlə yetirsən, həqiqətən, bizim qayıdacağımız yer Allah-Təalanın tərəfinədir. Bizə əcr və savab bəxş edəcəkdir.**

**126) (وَمَا تَنْقِمُ مِنَّٓا اِلَّٓا اَنْ اٰمَنَّا بِاٰيَاتِ رَبِّنَا لَمَّا جَٓاءَتْنَا) – sən bizdən ancaq rəbbimiz Allah-Təalanın möcüzələri bizə gəldiyində onlara iman gətirdiyimiz üçün intiqam alırsan. Görək Allah-Təala aramızda necə hökm edər.** (Ondan sonra sehrbazlar dua etdilər). **(رَبَّنَٓا اَفْرِغْ عَلَيْنَا صَبْرًا) – ey bizim rəbbimiz, bizim qəlblərimizi səbirlə doldur, (وَتَوَفَّنَا مُسْلِمِينَ) – bizləri sənə itaət və bəndəlikdə olduğumuz halında vəfat etdir.** (Firon əmr etdi, bütün sehrbazları həlak edib, ondan sonra Musanın işi haqda məşvərət etdilər).

**127) (وَقَالَ الْمَلَاُ مِنْ قَوْمِ فِرْعَوْنَ) – şurada fironun camaatından böyük şəxslər firona dedilər: (اَتَذَرُ مُوسٰى وَقَوْمَهُ) – “Bəs Musanı və onun qövmünü salamat qoyacaqsan ki, (لِيُفْسِدُوا فِي الْاَرْضِ) – Misirdə fəsad törətsinlər? (وَيَذَرَكَ وَاٰلِهَتَكَ) – özü də elə bir halda ki, Musa sənin özünü və məbudlarını tərk edib sənə etina etməsin? Bunları bu halətdə qoymaq olmaz”.** (Firon özü bütə sitayiş edib amma xalqın özünə sitayiş etməsini əmr edirdi). **(قَالَ سَنُقَتِّلُ اَبْنَٓاءَهُمْ) – firon dedi: “Əlbəttə, onların oğullarını qətlə yetirərik. (وَنَسْتَحْيِي نِسَٓاءَهُمْ) – qadınlarını da sağ qoyarıq. (وَاِنَّا فَوْقَهُمْ قَاهِرُونَ) – həqiqətən, biz onların üstündə hakim və qalibik. Onları istədiyimiz kimi idarə edə bilərik. Heç kim bizə mane ola bilməz.** (Musanın qövmü bəni-İsrail fironun bu sözündən qorxuya düşdülər, çünki Musa anadan olan dövrdə fironun əzabını və onların uşaqlarını qətlə yetirdiyini görmüşdülər. Son dərəcə qorxuya düşüb ah-fəğan etdilər. Hz. Musa onlara təsəlli etməyə başladı).

قَالَ مُوسٰى لِقَوْمِهِ اسْتَعٖينُوا بِاللّٰهِ وَاصْبِرُواۚ اِنَّ الْاَرْضَ لِلّٰهِۙ يُورِثُهَا مَنْ يَشَٓاءُ مِنْ عِبَادِهٖۜ وَالْعَاقِبَةُ لِلْمُتَّقٖينَ ﴿١٢٨﴾ قَالُوٓا اُوذٖينَا مِنْ قَبْلِ اَنْ تَأْتِيَنَا وَمِنْ بَعْدِ مَا جِئْتَنَاۜ قَالَ عَسٰى رَبُّكُمْ اَنْ يُهْلِكَ عَدُوَّكُمْ وَيَسْتَخْلِفَكُمْ فِي الْاَرْضِ فَيَنْظُرَ كَيْفَ تَعْمَلُونَ ﴿١٢٩﴾ وَلَقَدْ اَخَذْنَٓا اٰلَ فِرْعَوْنَ بِالسِّنٖينَ وَنَقْصٍ مِنَ الثَّمَرَاتِ لَعَلَّهُمْ يَذَّكَّرُونَ ﴿١٣٠﴾ فَاِذَا جَٓاءَتْهُمُ الْحَسَنَةُ قَالُوا لَنَا هٰذِهٖۚ وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ يَطَّيَّرُوا بِمُوسٰى وَمَنْ مَعَهُۜ اَلَٓا اِنَّمَا طَٓائِرُهُمْ عِنْدَ اللّٰهِ

---

**128) (قَالَ مُوسٰى لِقَوْمِهِ) – Musa bəni İsrailə dedi: “Qorxub ah-fəğan etməyin. (اسْتَعٖينُوا بِاللّٰهِ وَاصْبِرُوا) – Allah-Təaladan kömək istəyib səbir edin. (اِنَّ الْاَرْضَ لِلّٰهِ) – yerin ixtiyarı və səltənəti Allah-Təalanın qüdrətinə tabedir. (يُورِثُهَا مَنْ يَشَٓاءُ مِنْ عِبَادِهٖ) – öz qullarından istədiyini öz yerinə və mülkünə varis edər.** (Allah-Təalanın qüdrəti vardır ki, fironu həlak edib siz bəni-İsrailə nicat versin, nədən ötrü ah-fəğan edirsiniz?) **(وَالْعَاقِبَةُ لِلْمُتَّقٖينَ) – sonunda qələbə müttəqilərindir”.**

**129) (قَالُوٓا اُوذٖينَا مِنْ قَبْلِ اَنْ تَأْتِيَنَا وَمِنْ بَعْدِ مَا جِئْتَنَا) – bəni-İsrail dedi: “Ey Musa, sən dünyaya gəlib peyğəmbər olmadan qabaq firondan çox əziyyət çəkdik. İndi sən peyğəmbər olubsan, yenə firondan əziyyət çəkirik. Sən bizə fironun əziyyətindən xilas olmağı vəd etdin. Bəs nə vaxt onun əziyyətindən xilas olacağıq?” (قَالَ عَسٰى رَبُّكُمْ اَنْ يُهْلِكَ عَدُوَّكُمْ) – Musa dedi: “Təşviş etməyin. Ümidvar olun ki, Allah-Təala tezliklə sizin düşməniniz fironu həlak edib, (وَيَسْتَخْلِفَكُمْ فِي الْاَرْضِ) – sizi Misirdə ona varis edər. (فَيَنْظُرَ كَيْفَ تَعْمَلُونَ) – o vaxt da Allah-Təala baxıb görər ki, siz necə əməl edirsiniz, Allah-Təalanın nemətlərinə şükür, yoxsa nankorluq edirsiniz?** *(Hz. Musa bəni-İsraili əvvəlcədən Allah-Təalaya şükür etməyə vadar etməkdən ötrü bu kəlamı bəni-İsrailə bildirdi. Elə ki firon və ona tabe olanlar küfrlərində israr etdilər, Allah-Təala da onları cürbəcür bəlalara düçar etdi ki, bəlkə, ibrət alıb iman gətirsinlər. Lakin iman gətirmədilər, necə ki buyurur:)*

**130) (وَلَقَدْ اَخَذْنَٓا اٰلَ فِرْعَوْنَ بِالسِّنٖينَ وَنَقْصٍ مِنَ الثَّمَرَاتِ) – həqiqətən, firona tabe olub Musaya iman gətirməyənləri illərlə quraqlığa və məhsul qıtlığına düçar etdik ki, (لَعَلَّهُمْ يَذَّكَّرُونَ) – bəlkə, ibrət alsınlar ki, bu bəlalar Musaya iman gətirməyib küfr içində qaldıqları üçündür. O vaxt da iman gətirsinlər.**

**131) (فَاِذَا جَٓاءَتْهُمُ الْحَسَنَةُ قَالُوا لَنَا هٰذِهٖ) – Misir əhlinə bol nemətlər gələndə deyirdilər: “Bu nemətlər bizdən ötrüdür. Biz yaxşı olduğumuza görə, bu nemətlər bizə bəxş olunur. (وَاِنْ تُصِبْهُمْ سَيِّئَةٌ) – onlara sıxıntı və aclıq yetişəndə isə, (يَطَّيَّرُوا بِمُوسٰى وَمَنْ مَعَهُ) – Musanı və ona iman gətirənləri nəhs sayıb deyərdilər: “Bu qəhətlik və aclıq bizə onların uğursuzluğundan və nəhsliyindən gəlir.** (Allah-Təala onların cavabında buyurur:) **(اَلَٓا اِنَّمَا طَٓائِرُهُمْ عِنْدَ اللّٰهِ)** – (ey Məhəmməd), **onlar Musanı nəhs sayıb, o bəlaları Musanın**

وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿١٣١﴾ وَقَالُوا مَهْمَا تَأْتِنَا بِهٖ مِنْ اٰيَةٍ لِتَسْحَرَنَا بِهَاۙ فَمَا نَحْنُ لَكَ بِمُؤْمِنٖينَ ﴿١٣٢﴾
فَاَرْسَلْنَا عَلَيْهِمُ الطُّوفَانَ وَالْجَرَادَ وَالْقُمَّلَ وَالضَّفَادِعَ وَالدَّمَ اٰيَاتٍ مُفَصَّلَاتٍ فَاسْتَكْبَرُوا

---

**uğursuzluğundan görürdülər, belə deyil, xəbərdar ol ki, onların öz uğursuzluqları Allah-Təalaya məlumdur. O bəlaların səbəbi öz nəhslikləridir. (وَلٰكِنَّ اَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) – amma onların əksəriyyəti agah deyil ki, o bəlalar öz uğursuzluqlarındandır. O səbəbdən Musaya nisbət edirlər.**

**132) (وَقَالُوا مَهْمَا تَأْتِنَا بِهٖ مِنْ اٰيَةٍ لِتَسْحَرَنَا بِهَاۙ)** – (Musaya) **dedilər: "Ey Musa, bizi sehrləyib özünə tabe etmək üçün nə möcüzə** (sən ona möcüzə deyirsən) **gətirsən, (فَمَا نَحْنُ لَكَ بِمُؤْمِنٖينَ) – əlbəttə, biz sənə iman gətirib sənin sözlərini qəbul edən deyilik.**

**133) (فَاَرْسَلْنَا عَلَيْهِمُ الطُّوفَانَ) – ondan sonra onlara yağış və sel göndərdik.** (Nil çayı tüğyan edib, bütün qibtilərin evlərini su basıb, xarab edib, əksəriyyəti suya qərq oldu. Dedilər: "Ey Musa, bizi bu bəladan qurtar, imana gəlib Allah-Təalaya sitayiş edərik". Hz. Musa dua etdi, yağış dayanıb, Nil çayı da sakitləşdi. Qibtilər nicat tapdılar. O il çox yaxşı məhsulları oldu, amma iman gətirmədilər)**. (وَالْجَرَادَ) – elə ki iman gətirmədilər, çəyirtkəni onlara bəla göndərdik.** (Bütün əkinlərini, bağlarını, meyvələrini çəyirtkə yedi. Ondan sonra qibtilərin evlərinə dolub, libaslarını, evlərinin əşyalarını parça-parça etdi. Qibtilər Musanın yanına gəlib ağlayıb-sızlayıb dedilər: "Ey Musa, bu bəlanı bizdən dəf et, biz də imana gələrik". Hz. Musa dua etdi, çəyirtkələr çəkildi. Bir ay keçdi, yenə imana gəlmədilər). **(وَالْقُمَّلَ) – ondan sonra gənəni* onlara bəla göndərib bədənlərinə düçar etdik.** (Bütün evləri, qabları və yeməkləri gənə ilə dolub bədənlərinə yapışıb, qanlarını içdi, sanki, bədənləri çiçək çıxartmış kimi oldu. Hz. Musanın yanına gəlib fəryad, ah-nalə edib iman edəcəklərini vəd etdilər. Hz. Musa dua etdi, o bəla da dəf oldu. Bir ay keçdi, yenə imana gəlməyib dedilər: "Bizə tam agah oldu ki, sən sehrbazsan. And olsun fironun izzətinə ki, heç vaxt sənə iman gətirmərik".) **(وَالضَّفَادِعَ) – ondan sonra qurbağanı onlara bəla göndərdik. Evləri, qabları tamamən qurbağa ilə doldu.** (Təngə gəlib Musanın yanına gəlib, tövbə edib dedilər: "Əgər bu bəlanı bizdən dəf etsən, iman edərik". Hz. Musa dua edib o bəlanı dəf etdi. Elə ki bəladan qurtuldular, yenə əhdlərini pozub iman etmədilər). **(وَالدَّمَ) – ondan sonra qanı onlara bəla etdik. Burunlarından qan axmağa başladı.** (Bir çoxları bu səbəbdən həlak oldu, Hz. Musanın yanına gəlib dedilər: "Ey Musa, neçə dəfə sənə vəd etsək də, əməl etməmişik. Bu dəfə söz veririk ki, iman edəcəyik, bizə rəhm edib dua et. Bu bəlanı bizdən dəf et". Hz. Musa dua edib, o bəlanı dəf etdi. Bir müddət keçəndən sonra o bəlaları unudub, küfr və inadlarına davam etdilər). **(اٰيَاتٍ مُفَصَّلَاتٍ) - bunlar müfəssəl izah edilib, zahir və aşkar olan möcüzələrdir ki, Hz. Musaya bəxş etmişdik. (فَاسْتَكْبَرُوا) – qibtilər**

وَكَانُوا قَوْمًا مُجْرِمِينَ ﴿١٣٣﴾ وَلَمَّا وَقَعَ عَلَيْهِمُ الرِّجْزُ قَالُوا يَا مُوسَى ادْعُ لَنَا رَبَّكَ بِمَا عَهِدَ عِنْدَكَ
لَئِنْ كَشَفْتَ عَنَّا الرِّجْزَ لَنُؤْمِنَنَّ لَكَ وَلَنُرْسِلَنَّ مَعَكَ بَنِيَ اِسْرَآءِيلَ ﴿١٣٤﴾ فَلَمَّا كَشَفْنَا عَنْهُمُ الرِّجْزَ
اِلَى اَجَلٍ هُمْ بَالِغُوهُ اِذَا هُمْ يَنْكُثُونَ ﴿١٣٥﴾ فَانْتَقَمْنَا مِنْهُمْ فَاَغْرَقْنَاهُمْ فِي الْيَمِّ بِاَنَّهُمْ كَذَّبُوا بِاٰيَاتِنَا
وَكَانُوا عَنْهَا غَافِلِينَ﴿١٣٦﴾ وَاَوْرَثْنَا الْقَوْمَ الَّذِينَ كَانُوا يُسْتَضْعَفُونَ مَشَارِقَ الْاَرْضِ وَمَغَارِبَهَا الَّتِي
بَارَكْنَا فِيهَا وَتَمَّتْ كَلِمَتُ رَبِّكَ الْحُسْنٰى عَلٰى بَنِيَ اِسْرَآءِيلَ بِمَا صَبَرُوا

---

**təkəbbürlənib iman gətirmədilər.** (وَكَانُوا قَوْمًا مُجْرِمِينَ) **– onlar asi və günahkar bir camaat idi.** (Qibtilər bu bəlalara düçar olsa da, bəni-İsrailə bir zərəri olmurdu. O səbəbdən bunlar Hz. Musa üçün möcüzə sayılır. Bu bəlalardan sonra Allah-Təala onlara taun göndərib qibtilərin əksəriyyəti həlak oldu. Firon özü və əyanları Musaya yalvardılar ki, bu bəlanı bizdən dəf et, həm sənə iman gətirərik, həm də bəni-İsraildən əl çəkib, onları sənə həvalə edərik. Hz. Musa dua edib, bəlanı dəf etdi, amma yenə iman gətirmədilər, necə ki növbəti ayədə xəbər verir).

**134)** (وَلَمَّا وَقَعَ عَلَيْهِمُ الرِّجْزُ) **– elə ki onlara taun vaqe oldu,** (قَالُوا يَا مُوسَى ادْعُ لَنَا رَبَّكَ بِمَا عَهِدَ عِنْدَكَ) **– qibtilər dedilər: "Ey Musa, səndə olan o peyğəmbərlik haqqına görə dua edib rəbbin Allah-Təalanı çağır ki, bu bəlanı bizdən dəf etsin.** (لَئِنْ كَشَفْتَ عَنَّا الرِّجْزَ) – (ey Musa), **əgər dua edib bu taunu bizdən dəf etsən,** (لَنُؤْمِنَنَّ لَكَ) **– əlbəttə, sənə iman gətirərik".** (وَلَنُرْسِلَنَّ مَعَكَ بَنِيَ اِسْرَآءِيلَ) **– bəni İsraildən əl çəkib səninlə birlikdə istədiyin yerə göndərərik, hara istəyirsənsə, ora da apar.** (Hz. Musa dua edib, bəlanı onlardan dəf etdi).

**135)** (فَلَمَّا كَشَفْنَا عَنْهُمُ الرِّجْزَ اِلَى اَجَلٍ هُمْ بَالِغُوهُ) **– elə ki Hz. Musa dua edib, taunu onlardan dəf etdik, taunu onlardan götürməyimiz müəyyən bir vaxta qədər idi ki, onlara möhlət verilib, o vaxta yetişsinlər. (elə ki iman gətirmədilər, o müəyyən vaxtda onlara əzab nazil edib hamısını dənizdə qərq etdik).** (اِذَا هُمْ يَنْكُثُونَ) **– elə ki taun bəlasından qurtuldular, qəfildən əhdi pozub,yenə imana gəlmədilər.**

**136)** (فَانْتَقَمْنَا مِنْهُمْ) **– onlardan intiqam alıb,** (فَاَغْرَقْنَاهُمْ فِي الْيَمِّ بِاَنَّهُمْ كَذَّبُوا بِاٰيَاتِنَا) **– ayələrimizi təkzib etdiklərinə görə biz də onları dənizdə** (Qırmızı dənizdə) **qərq etdik.** (وَكَانُوا عَنْهَا غَافِلِينَ) **– bizim ayələrimizdən və möcüzələrimizdən qafil olub fikir vermirdilər.**

**137)** (وَاَوْرَثْنَا الْقَوْمَ الَّذِينَ كَانُوا يُسْتَضْعَفُونَ) **– fironu və onun qövmünü həlak edəndən sonra zəif olan bəni-İsraili varis etdik.** (مَشَارِقَ الْاَرْضِ وَمَغَارِبَهَا) **– Şam və Misir yerinin məşriq və məğrib tərəflərinə** (bütün o yerləri bəni-İsrailin ixtiyarına verdik). (الَّتِي بَارَكْنَا فِيهَا) **– bəni-İsrailə verdiyimiz yerlər o yerlərdir ki, xeyir və bərəkətlə bol nemət vermişdik.** (وَتَمَّتْ كَلِمَتُ رَبِّكَ الْحُسْنٰى عَلٰى بَنِيَ اِسْرَآءِيلَ بِمَا صَبَرُوا) – (ey Məhəmməd), **bəni-İsrail firondan yetişən bəlalara**

وَدَمَّرْنَا مَا كَانَ يَصْنَعُ فِرْعَوْنُ وَقَوْمُهُ وَمَا كَانُوا يَعْرِشُونَ ﴿١٣٧﴾ وَجَاوَزْنَا بِبَنِيَ اِسْرَآءِيلَ الْبَحْرَ
فَاَتَوْا عَلٰى قَوْمٍ يَعْكُفُونَ عَلٰى اَصْنَامٍ لَهُمْ قَالُوا يَا مُوسَى اجْعَلْ لَنَآ اِلٰهًا كَمَا لَهُمْ اٰلِهَةٌ قَالَ اِنَّكُمْ قَوْمٌ
تَجْهَلُونَ﴿١٣٨﴾ اِنَّ هٰؤُلَآءِ مُتَبَّرٌ مَا هُمْ فِيهِ وَبَاطِلٌ مَا كَانُوا يَعْمَلُونَ ﴿١٣٩﴾ قَالَ اَغَيْرَ اللّٰهِ اَبْغِيكُمْ
اِلٰهًا وَهُوَ فَضَّلَكُمْ عَلَى الْعَالَمِينَ﴿١٤٠﴾ وَاِذْ اَنْجَيْنَاكُمْ مِنْ اٰلِ فِرْعَوْنَ يَسُومُونَكُمْ سُوٓءَ الْعَذَابِ
يُقَتِّلُونَ اَبْنَاءَكُمْ وَيَسْتَحْيُونَ نِسَآءَكُمْ وَفِي ذٰلِكُمْ بَلَآءٌ مِنْ رَبِّكُمْ عَظِيمٌ ﴿١٤١﴾

---

**səbir etdiyi üçün sənin rəbbin Allah-Təalanın bəni-İsrailin haqqındakı gözəl sözü** (necə ki buyurmuşdu: fironu həlak edib bəni-İsrailə nicat verəcəyəm)- **reallaşdı. Fironu həlak edib, bəni-İsrailə nicat verdi. (**وَدَمَّرْنَا مَا كَانَ **يَصْنَعُ فِرْعَوْنُ وَقَوْمُهُ) – firon və qibtilərin qurduqları qəsrlərin və imarətlərin hamısını xarab etdik. (**وَمَا كَانُوا يَعْرِشُونَ**) – və onların bağlarını və dirəklərin üstündə yetişdirdikləri üzüm salxımlarını da xarab etdik.**

**138) (**وَجَاوَزْنَا بِبَنِيَ اِسْرَآءِيلَ الْبَحْرَ**) – elə ki fironu qərq edib, bəni-İsrailə nicat verib dənizdən keçirdik, (**فَاَتَوْا عَلٰى قَوْمٍ يَعْكُفُونَ عَلٰى اَصْنَامٍ لَهُمْ**) – dənizdən nicat tapandan sonra bütləri** (öküz surətli bütləri) **olub o bütlərə ibadət edən bir camaata rast gəldilər. (**قَالُوا يَا مُوسَى اجْعَلْ لَنَآ اِلٰهًا كَمَا لَهُمْ اٰلِهَةٌ**) – dedilər: “Ey Musa, bizə də o camaatın məbudları, bütləri kimi bütlərdən bir məbud düzəlt”. (**قَالَ اِنَّكُمْ قَوْمٌ تَجْهَلُونَ**) – Hz. Musa qəzəblənib dedi: “Həqiqətən, siz cahil olan camaatsınız. Haqla batilə fərq qoymursunuz”.**

**139) (**اِنَّ هٰؤُلَآءِ مُتَبَّرٌ مَا هُمْ فِيهِ**) – Həqiqətən, bu bütpərəstlərin dini məhv olub dağılandır. Allah-Təala o dini mənim əlimdə məhv edəcəkdir. (**وَبَاطِلٌ مَا كَانُوا يَعْمَلُونَ**) – etdikləri əməlləri də batildir, müşrik olduqlarına görə, o əməlləri onlara fayda verməyəcəkdir.**

**140) (**قَالَ اَغَيْرَ اللّٰهِ اَبْغِيكُمْ اِلٰهًا**) –** (Musa) **dedi: “Ey bəni-İsrail, necə də ağılsız bir camaatsınız, bəs sizdən ötrü Allah-Təaladan başqa batil olan məbudları istəyim? (**وَهُوَ فَضَّلَكُمْ عَلَى الْعَالَمِينَ**) – halbuki Allah-Təala sizi öz aləmlərinizdə olan məxluqata üstün edib, sizi dənizdən xilas etdi. Gərək, Allah-Təalaya ibadət edib, ona şərik qoşmayasınız, nəinki Allah-Təaladan başqa batil məbud istəyəsiniz.**

**141) (**وَاِذْ اَنْجَيْنَاكُمْ مِنْ اٰلِ فِرْعَوْنَ**) –** (Musa dedi: “Ey bəni-İsrail, Allah-Təala buyurur:) **yadınıza o zamanı salın ki, mən sizi fironun əhlindən xilas etdim. (**يَسُومُونَكُمْ سُوٓءَ الْعَذَابِ**) – özü də elə bir halətdə ki, sizdən ötrü şiddətli əzablar istəyib axtarırdılar. (**يُقَتِّلُونَ اَبْنَاءَكُمْ**) – o əzablar bu idi ki, sizin oğullarınızı qətlə yetirib, (**وَيَسْتَحْيُونَ نِسَآءَكُمْ**) – qadınlarınızı sağ qoyurdular. (**وَفِي ذٰلِكُمْ بَلَآءٌ مِنْ رَبِّكُمْ عَظِيمٌ**) – bu bəlalardan sizə nicat verməkdə sizdən ötrü rəbbiniz Allah-Təaladan böyük nemətlər vardır, gərək o nemətlərə şükür edəsiniz, nəinki kafir olub bütləri məbud etmək istəyəsiniz. (Hz. Musa Misirdə**

وَوٰعَدْنَا مُوسٰى ثَلٰثِينَ لَيْلَةً وَاَتْمَمْنَاهَا بِعَشْرٍ فَتَمَّ مِيقَاتُ رَبِّهٖٓ اَرْبَعِينَ لَيْلَةً ۚ وَقَالَ مُوسٰى لِاَخِيهِ هٰرُونَ اخْلُفْنِي فِي قَوْمِي وَاَصْلِحْ وَلَا تَتَّبِعْ سَبِيلَ الْمُفْسِدِينَ ﴿١٤٢﴾ وَلَمَّا جَٓاءَ مُوسٰى لِمِيقَاتِنَا وَكَلَّمَهُ رَبُّهُ ۙ قَالَ رَبِّ اَرِنِيٓ اَنْظُرْ اِلَيْكَ ۜ قَالَ لَنْ تَرٰينِي

---

**olanda bəni-İsrailə vəd etmişdi ki, Allah-Təala fironu həlak edəndən sonra sizə elə bir kitab verəcəkdir ki, onda bütün hökmlər onda olacaq. Elə ki Allah-Təala fironu dənizdə həlak edib, bəni-İsrailə nicat verdi, Musadan o kitabı istədilər, Musa da Allah-Təaladan istədi. Allah-Təala Musaya əmr etdi ki, 30 gün oruc tut. Ondan sonra Turi-Sinaya gəl, orada sənə kitab göndəcəm. Hz. Musa 30 gün oruc tutdu, oruc tutan şəxsin ağzında qoxu meydana gəldiyi üçün Hz. Musa iftar etdi ki, ağzındakı o pis qoxu getsin. Ondan sonra Turi-Sinaya getdi. Xitab gəldi: "Ey Musa, niyə iftar edib gəldin, sən bilmirsən ki,** (nəinki sadəcə yemək-içməkdən, həm də qəbih sözlərdən) **oruc tutanın ağzının qoxusu mənim yanımda müşkdən daha yaxşıdır. Ona görə sənə tənbeh olunur ki, 10 gün daha oruc tut ki, orucun qoxusu yerinə gəlsin".** (Musanın ağzından nə söz çıxmışdı ki, Allah-Təala onu 10 gün əlavə oruc tutmağı əmr etdi). Hz. Musa 10 gün daha oruc tutub, hamısı bir yerdə 40 gün oldu. Ondan sonra gedib dua etdi ki, qövmünün istəyinə görə, Allah-Təalanı görsün. Bu istəyi rədd olundu, ondan sonra lövhələrdə yazılmış Tövrat Musaya nazil oldu , necə ki sıradakı ayədə xəbər verir).

**142) (وَوٰعَدْنَا مُوسٰى ثَلٰثِينَ لَيْلَةً)** – (ey Məhəmməd), **Musa ilə vədələşdik ki, 30 gecə ibadət edib, gündüzləri oruc tutsun. Ondan sonra Tövratdan ötrü Turi-Sinaya gəlsin. (وَاَتْمَمْنَاهَا بِعَشْرٍ ) – otuz gündən sonra iftar etdiyi üçün ona on gün daha oruc tutmağı əlavə edib tamamladıq. (فَتَمَّ مِيقَاتُ رَبِّهٖٓ اَرْبَعِينَ لَيْلَةً) – beləliklə, Musanın rəbbi Allah-Təalanın təyin etdiyi 40 gecəlik** (günlük) **ibadət və oruc tamam oldu, 40 gecədən sonra Musa Turi-Sinaya getdi. (وَقَالَ مُوسٰى لِاَخِيهِ هٰرُونَ اخْلُفْنِي فِي قَوْمِي) – Musa Turi-Sinaya gedəndə qardaşı Haruna dedi: "Mənim qövmümün arasında mənim xəlifəm və varisim ol. (وَاَصْلِحْ) – həmişə bəni-İsrail arasında sülhü təmin edib, onların işlərini islah et. (وَلَا تَتَّبِعْ سَبِيلَ الْمُفْسِدِينَ) – fəsadçı şəxslərin yoluna tabe olma.**

**143) (وَلَمَّا جَٓاءَ مُوسٰى لِمِيقَاتِنَا) – 40 gün-40 gecə tamam olub Musa bizim müəyyən etdiyimiz vaxtda Turi-Sinaya gəldiyində, (وَكَلَّمَهُ رَبُّهُ) – rəbbi Allah-Təala onunla bir vasitə* olmadan danışdı.** (Bəni-İsrail tüğyan edib Musaya dedi: "Allah-Təalanı gözümüzlə açıq-aşkar görənə qədər sənə iman gətirmərik," bu mətləb Bəqərə surəsinin 55-ci ayəsində qeyd olunmuşdu. Hz. Musa onların istəyinə görə, Allah-Təaladan ona görünməsini istədi. Cavab gəldi ki, məni əsla görmək olmaz, necə ki buyurur). **(قَالَ رَبِّ اَرِنِيٓ اَنْظُرْ اِلَيْكَ ۜ قَالَ لَنْ تَرٰينِي)** – (Allah-Təala buyurdu: "Ey Musa), **məni əsla görə bilməzsən,** (gözdə o güc yoxdur

وَلٰكِنِ انْظُرْ اِلَى الْجَبَلِ فَاِنِ اسْتَقَرَّ مَكَانَهُ فَسَوْفَ تَرٰينِيۚ فَلَمَّا تَجَلّٰى رَبُّهُ لِلْجَبَلِ جَعَلَهُ دَكًّا وَخَرَّ مُوسٰى صَعِقًاۚ فَلَمَّٓا اَفَاقَ قَالَ سُبْحَانَكَ تُبْتُ اِلَيْكَ وَاَنَا۬ اَوَّلُ الْمُؤْمِنِينَ ﴿١٤٣﴾ قَالَ يَا مُوسٰٓى اِنّ۪ي اصْطَفَيْتُكَ عَلَى النَّاسِ بِرِسَالَاتٖي وَبِكَلَامٖيۘ فَخُذْ مَٓا اٰتَيْتُكَ وَكُنْ مِنَ الشَّاكِر۪ينَ ﴿١٤٤﴾ وَكَتَبْنَا لَهُ فِي الْاَلْوَاحِ مِنْ كُلِّ شَيْءٍ مَوْعِظَةً وَتَفْص۪يلًا لِكُلِّ شَيْءٍۚ

---

ki, məni görə bilsin). **(وَلٰكِنِ انْظُرْ اِلَى الْجَبَلِ فَاِنِ اسْتَقَرَّ مَكَانَهُ) – (ey Musa, məni görmək imkansızdır, lakin başqa bir şəkildə görmək olar. O da budur ki), dağa bax,** (gör bu dağ sənin bu sualından sonra yerində durur, yoxsa yox? Yerində durub, parçalanıb dağılmasa), **(فَسَوْفَ تَرٰينِيۚ) – məni də o zaman görə bilərsən. (فَلَمَّا تَجَلّٰى رَبُّهُ لِلْجَبَلِ)** – (ey Məhəmməd)**, Musanın rəbbi Allah-Təalanın iqtidarı, əzəmət və iradəsi o dağa təcəlli edib, onu dağıtmaq istədikdə, (جَعَلَهُ دَكًّا) – həmin o dağı parça-parça etdi.** (Necə ki bir şeyə başqa bir möhkəm şeylə vuranda parçalanıb dağılır, o dağ da o cür parçalanıb biyabana dağıldı. Yəni ey Musa, sən soruşduğun söz elə sözdür ki, dağ da onun heybətinə tab gətirməyib parça-parça olur, heç mümkündür ki, Allah-Təala bu göz ilə dərk olunsun?) **(وَخَرَّ مُوسٰى صَعِقًاۚ) – elə ki Musa o dağın parçalandığını gördü, sanki, ölmüş kimi bayılıb düşdü. (فَلَمَّٓا اَفَاقَ) – Musa ayılanda isə o sualından tövbə edib, (قَالَ سُبْحَانَكَ تُبْتُ اِلَيْكَ) – dedi: "İlahi, gözlə görünməkdən pak və müqəddəssən, dediyim sözdən peşman olub, tövbə edib sənin tərəfinə qayıtdım. (وَاَنَا۬ اَوَّلُ الْمُؤْمِنِينَ) – mən ilk iman gətirənlərdənəm, inanıram ki, səni görmək imkansızdır, heç kim səni dərk edə bilməz.** (Müsəlmanlardan böyük bir qrup deyir ki, Allah-Təalanı bu dünyada görmək olmaz, amma axirətdə qiyamət günündə hər kəs Allah-Təalanı görəcək, bu haqda bir çox hədislər də nəql edirlər və deyirlər ki, Hz. Musa Allah-Təalanın dünyada görünməsini istədiyi üçün istəyi rədd edildi. Hz. Musanın Allah-Təalanın qiyamət günündə görünəcəyinə şübhəsi yox idi, yoxsa heç vaxt Onun görünməsini xahiş etməzdi. Bu haqda müxtəlif dəlillər gətirsələr də, hamısı mənasız sözlərdir. Yuxarıdakı ayə onların iddiasının rədd edilməsi üçün kafidir, başqa dəlil gətirməyə ehtiyac yoxdur).

*(*__Qeyd:__ Allah-Təala Musa ilə danışanda Hz. Musa Allah-Təalanın kəlamını 6 tərəfdən eşidərdi, Allah-Təalanın danışması sözü yaradıb, sanki bir danışanın danışması kimidir. Səsi və digər cismləri yaratdığı kimi sözü də yaradar. Səs və sözün hər ikisi cismdir, cismlər Allah-Təalanın məxluqu olduğu kimi, habelə səs və söz də məxluqdur).*

**144) (قَالَ يَا مُوسٰٓى) – Allah-Təala buyurdu: "Ey Musa, (اِنّ۪ي اصْطَفَيْتُكَ عَلَى النَّاسِ بِرِسَالَاتٖي وَبِكَلَامٖيۘ) – həqiqətən, mən səni özümə peyğəmbər edib, səninlə danışmaqla səni xalqa üstün etdim. (فَخُذْ مَٓا اٰتَيْتُكَ وَكُنْ مِنَ الشَّاكِر۪ينَ) – sənə verdiyim peyğəmbərliyi, hikmət və Tövratı alıb şükür edənlərdən ol.**

**145) (وَكَتَبْنَا لَهُ فِي الْاَلْوَاحِ مِنْ كُلِّ شَيْءٍ مَوْعِظَةً وَتَفْص۪يلًا لِكُلِّ شَيْءٍۚ) – Musadan ötrü lövhələrdə bəni-İsrailin din və dünya işlərində möhtac olduğu şeyləri, vəz**

فَخُذْهَا بِقُوَّةٍ وَاْمُرْ قَوْمَكَ يَاْخُذُوا بِاَحْسَنِهَاۜ سَاُرِيكُمْ دَارَ الْفَاسِقِينَ ﴿١٤٥﴾ سَاَصْرِفُ عَنْ اٰيَاتِيَ
الَّذِينَ يَتَكَبَّرُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّۜ وَاِنْ يَرَوْا كُلَّ اٰيَةٍ لَا يُؤْمِنُوا بِهَاۚ وَاِنْ يَرَوْا سَبِيلَ الرُّشْدِ لَا
يَتَّخِذُوهُ سَبِيلًاۚ وَاِنْ يَرَوْا سَبِيلَ الْغَيِّ يَتَّخِذُوهُ سَبِيلًاۜ ذٰلِكَ بِاَنَّهُمْ كَذَّبُوا بِاٰيَاتِنَا وَكَانُوا عَنْهَا غَافِلِينَ
﴿١٤٦﴾ وَالَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا وَلِقَاۤءِ الْاٰخِرَةِ حَبِطَتْ اَعْمَالُهُمْۜ

---

**və nəsihəti və hər bir şeyin hökmünü təfsilatı ilə yazıb bəyan etdik, ondan sonra Musaya dedik: (فَخُذْهَا بِقُوَّةٍ)** – (ey Musa)**, bu Tövratı möhkəm niyyət ilə alıb onun hökmlərini xalqa çatdırmaqda əzmli ol. (وَاْمُرْ قَوْمَكَ يَاْخُذُوا بِاَحْسَنِهَا)** – (ey Musa)**, bəni-İsrailə əmr et ki, Tövratın* ən gözəl hökmlərini qəbul edib əməl etsinlər. (سَاُرِيكُمْ دَارَ الْفَاسِقِينَ) – əlbəttə, sizə fasiqlərin evlərini və mənzillərini göstərərəm ki, necə onları** (firon və onun camaatını) **həlak edib, imarətlərini xarab etdim.**

*(****Qeyd:** *Tövratın bəzi hökmləri gözəl, bəziləri də daha gözəldir. Məsələn, qisas almaq gözəldir, amma bağışlamaq daha gözəldir, zalımdan intiqam almaq gözəldir. Amma səbir etmək daha gözəldir, Quranın hökmü də belədir. Uhud savaşında şəhidlərin ağası Həmzəni qətlə yetirib ondan sonra onu "müslə" etdilər. Müslə - bir şəxs öldürüləndən sonra onun burun, qulaq, dodaqlarını kəsməyə deyirlər. Müslə - ərəblər arasında da son dərəcə qəbih olan bir şeydir. Hz. Peyğəmbər Həmzəni o halda görəndə son dərəcə qəzəbləndi, and içdi ki, Həmzənin əvəzinə 70 nəfər Qüreyşlini müslə edəcəm. O zaman Nəhl surəsinin sonundakı bu ayə nazil oldu: "Əgər cəza verəcəksinizsə, sizə edilən işgəncənin misli ilə cəza verin. Amma səbir etsəniz, əlbəttə o, səbir edənlər üçün daha xeyirlidir". Yəni sizə əzab edildiyi qədər əzab edin, ondan artıq əzab etmək olmaz. Bir nəfərin əvəzinə də bir nəfərə əzab edin, bağışlasanız isə daha yaxşı olar. Hz. Peyğəmbər andına kəffarə verib Həmzənin əvəzinə müslə etməyi tərk edib səbir etdi. Tövrat haqqında da bu mətləbi bəyan edir ki, onun hökmlərinin ən gözəlini qəbul edib əməl edin. Əlbəttə, insaniyyət xüsusiyyətlərinə sahib olanlar hər bir şeyin ən gözəlini gərək qəbul etsinlər).*

**146) (سَاَصْرِفُ عَنْ اٰيَاتِيَ الَّذِينَ يَتَكَبَّرُونَ فِي الْاَرْضِ بِغَيْرِ الْحَقِّ) – o şəxslər ki haqsız şəkildə yer üzündə təkəbbürlənir, onların bu təkəbbürlərinə görə, qəlblərinə möhür vurub, bizim ayə və möcüzələrimizə iman gətirməkdən onları geri çevirərəm. Əsla iman gətirməzlər. (وَاِنْ يَرَوْا كُلَّ اٰيَةٍ لَا يُؤْمِنُوا بِهَاۚ) – bizim tərəfimizdən nə möcüzə görsələr də, iman gətirməzlər. (وَاِنْ يَرَوْا سَبِيلَ الرُّشْدِ لَا يَتَّخِذُوهُ سَبِيلًاۚ) – əgər haqq və hidayət yolunu görsələr, onu özlərindən ötrü yol seçməzlər, (وَاِنْ يَرَوْا سَبِيلَ الْغَيِّ يَتَّخِذُوهُ سَبِيلًا) – amma əgər zəlalət yolunu görsələr, onu özlərindən ötrü yol seçərlər. (ذٰلِكَ بِاَنَّهُمْ كَذَّبُوا بِاٰيَاتِنَا) – onların haqqa tabe olmayıb zəlaləti seçmələrinin səbəbi bizim möcüzələrimizi təkzib etmələridir. (وَكَانُوا عَنْهَا غَافِلِينَ) – o möcüzələrdən qafil olub fikir vermirdilər.**

**147) (وَالَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا وَلِقَاۤءِ الْاٰخِرَةِ) – o şəxslər ki bizim möcüzələrimizlə və axirət günü ilə qarşılaşmağı təkzib eləmişdi, (حَبِطَتْ اَعْمَالُهُمْ) – o şəxslərin**

هَلْ يُجْزَوْنَ اِلَّا مَا كَانُوا يَعْمَلُونَ ﴿١٤٧﴾ وَاتَّخَذَ قَوْمُ مُوسٰى مِنْ بَعْدِه۪ مِنْ حُلِيِّهِمْ عِجْلًا جَسَدًا لَهُ
خُوَارٌ اَلَمْ يَرَوْا اَنَّهُ لَا يُكَلِّمُهُمْ وَلَا يَهْد۪يهِمْ سَب۪يلًاۢ اِتَّخَذُوهُ وَكَانُوا ظَالِم۪ينَ ﴿١٤٨﴾ وَلَمَّا سُقِطَ ف۪ٓي
اَيْد۪يهِمْ وَرَاَوْا اَنَّهُمْ قَدْ ضَلُّواۙ قَالُوا لَئِنْ لَمْ يَرْحَمْنَا رَبُّنَا وَيَغْفِرْ لَنَا لَنَكُونَنَّ مِنَ الْخَاسِر۪ينَ ﴿١٤٩﴾
وَلَمَّا رَجَعَ مُوسٰٓى اِلٰى قَوْمِه۪ غَضْبَانَ اَسِفًاۙ قَالَ بِئْسَمَا خَلَفْتُمُون۪ي مِنْ بَعْد۪يۚ اَعَجِلْتُمْ اَمْرَ رَبِّكُمْۚ

---

**dünyada etdikləri yaxşı əməllərinin hamısı batil oldu, o əməlləri onlara heç bir fayda verməz. (هَلْ يُجْزَوْنَ اِلَّا مَا كَانُوا يَعْمَلُونَ) – onlara ancaq dünyada etdikləri yaxşı əməllərinə görə axirətdə mükafat verilər, başqa necə onlara mükafat verilər? Mükafat olmayanda nicat da olmaz.**

**148) (وَاتَّخَذَ قَوْمُ مُوسٰى مِنْ بَعْدِه۪ مِنْ حُلِيِّهِمْ عِجْلًا جَسَدًا لَهُ خُوَارٌ) – Musa dağa gedəndən sonra bəni-İsrail öz qızıl zinətlərindən bir* buzov düzəlti. (اَلَمْ يَرَوْا اَنَّهُ لَا يُكَلِّمُهُمْ) – bəni-İsrail buzova necə ibadət edirdi, bəs görmədilər ki, o buzov onlarla danışmır? (وَلَا يَهْد۪يهِمْ سَب۪يلًاۢ) – və onları heç bir yola hidayət etmir? (اِتَّخَذُوهُ وَكَانُوا ظَالِم۪ينَ) – bununla belə o buzovu özlərinə məbud saydılar. Bəni-İsrail tayfası zalım bir tayfa idi. Heç bir şeyi öz yerində istifadə etməzdi. (Buzova sitayiş etmək onların ilk bidəti deyildi. Belə bidətləri çox olmuşdu.**

*(****Qeyd:** *O buzovu Samiri adında bir şəxs bəni-İsraildən ötrü düzəltmişdi. Onun adı Tövratda Harun kimi qeyd olunubdur. O, bəni-İsrailə belə demişdi: "Bu, sizin məbudunuzdur," bəni-İsrail də ona səcdə etdi. Bu məsələ Bəqərə surəsinin 49-cu ayəsində təfsilatı ilə qeyd olunmuşdu).*

**149) (وَلَمَّا سُقِطَ ف۪ٓي اَيْد۪يهِمْ) – Harun bəni-İsraili məzəmmət edib, onlar da buzova sitayiş etməkdən peşman olub barmaqlarını dişlədilər.** (Necə ki bir şəxs öz əməlindən peşmanda olanda əlini və barmaqlarını dişləyər). **Elə ki peşmançılıqdan bəni-İsrailin başı əlləri arasına düşüb, əllərini dişlədi, (وَرَاَوْا اَنَّهُمْ قَدْ ضَلُّواۙ) – baxıb gördülər ki, zəlalətə vaqe olublar. (قَالُوا لَئِنْ لَمْ يَرْحَمْنَا رَبُّنَا وَيَغْفِرْ لَنَا) – dedilər: "Əgər bizim rəbbimiz Allah-Təala bizə rəhm etməyib bizi bağışlamasa, (لَنَكُونَنَّ مِنَ الْخَاسِر۪ينَ) – əlbəttə, özümüzə ziyan verən şəxslərdən olacağıq.**

**150) (وَلَمَّا رَجَعَ مُوسٰٓى اِلٰى قَوْمِه۪ غَضْبَانَ اَسِفًاۙ) – elə ki Musa bəni-İsrail buzova sitayiş etdiyinə görə, qəzəblə dağdan qayıdıb bəni-İsrailin yanına gəldi, (قَالَ بِئْسَمَا خَلَفْتُمُون۪ي مِنْ بَعْد۪يۚ) – Haruna və möminlərə xitab edib buyurdu: "Mən dağa gedəndən sonra mənə nə pis varis oldunuz? Bu nədir ki bəni-İsrail buzova sitayiş edir, nəyə görə onlara mane olmadınız? (اَعَجِلْتُمْ اَمْرَ رَبِّكُمْۚ) – Allah-Təala siz bəni-İsrailə əmr buyurmuşdu ki, məni gözləyəsiniz ki, dağdan qayıdıb sizə kitab gətirim, məni gözləməyib, rəbbinizin əmrini** (əzabını) **tezləşdirmək istədiniz? Dediniz ki, Musa ölübdür, buzova sitayiş**

وَاَلْقَى الْاَلْوَاحَ وَاَخَذَ بِرَاْسِ اَخ۪يهِ يَجُرُّهُٓ اِلَيْهِۜ قَالَ ابْنَ اُمَّ اِنَّ الْقَوْمَ اسْتَضْعَفُون۪ي وَكَادُوا يَقْتُلُونَن۪يۘ فَلَا تُشْمِتْ بِيَ الْاَعْدَٓاءَ وَلَا تَجْعَلْن۪ي مَعَ الْقَوْمِ الظَّالِم۪ينَ ﴿١٥٠﴾ قَالَ رَبِّ اغْفِرْ ل۪ي وَلِاَخ۪ي وَاَدْخِلْنَا ف۪ي رَحْمَتِكَۘ وَاَنْتَ اَرْحَمُ الرَّاحِم۪ينَ۟ ﴿١٥١﴾ اِنَّ الَّذ۪ينَ اتَّخَذُوا الْعِجْلَ سَيَنَالُهُمْ غَضَبٌ مِنْ رَبِّهِمْ وَذِلَّةٌ فِي الْحَيٰوةِ الدُّنْيَاۜ وَكَذٰلِكَ نَجْزِي الْمُفْتَر۪ينَ ﴿١٥٢﴾ وَالَّذ۪ينَ عَمِلُوا السَّيِّـَٔاتِ ثُمَّ تَابُوا مِنْ بَعْدِهَا وَاٰمَنُواۘ اِنَّ رَبَّكَ مِنْ بَعْدِهَا لَغَفُورٌ رَح۪يمٌ ﴿١٥٣﴾

---

**etdiniz?”** (Hz. Musa bu sözləri deyib son dərəcə qəzəbləndi). (وَاَلْقَى الْاَلْوَاحَ) – **qəzəbindən Tövratın lövhələrini yerə atdı.** (Hz. Musa Allah-Təalanın dinini qorumada son dərəcə qeyrətli idi. Allahın əmrinə zidd iş görə bilməzdi). (وَاَخَذَ بِرَاْسِ اَخ۪يهِ يَجُرُّهُٓ اِلَيْهِ) – **qardaşı Harunun başından** (saçından) **tutub özünə tərəf çəkib dedi: “Nədən ötrü sən bəni-İsrailin buzova sitayiş etməsinə mane olmadın?** (قَالَ ابْنَ اُمَّ) – **Harun dedi: “Ey anamın oğlu, mənə hirslənmə. (Harun – ey anamın oğlu dedi ki, Musanın qəlbi yumşalıb onu vurmasın).** (اِنَّ الْقَوْمَ اسْتَضْعَفُون۪ي) – **bəni-İsrailin buzova sitayiş etməsini qadağan etsəm də, mənə qulaq asmadılar. Məni zəif hesab edib, az qaldılar ki, məni qətlə yetirsinlər.** (وَكَادُوا يَقْتُلُونَن۪يۘ فَلَا تُشْمِتْ بِيَ الْاَعْدَٓاءَ) – **düşmənləri sevindirmə, sənin məni belə zəlil etməyindən düşmənlər şad olarlar.** (وَلَا تَجْعَلْن۪ي مَعَ الْقَوْمِ الظَّالِم۪ينَ) – **mənə qəzəblənib məni bu buzova sitayiş edən zalımlarla bir sayıb onlardan hesab etmə.** (Harunun bu sözündən Hz. Musanın hirsi soyuyub Harundan əl çəkdi. Həm qardaşına qəzəbləndiyi üçün, həm də qardaşı Harun Allah-Təalanın əmrində bəlkə də, qüsur etdiyi üçün Allahdan bağışlanmalarını istədi. Necə ki sıradakı ayədə qeyd olunur).

**151)** (قَالَ رَبِّ اغْفِرْ ل۪ي وَلِاَخ۪ي) – **Musa dua edib dedi: “Ey mənim rəbbim, məni və qardaşım Harunu bağışlayıb,** (وَاَدْخِلْنَا ف۪ي رَحْمَتِكَ) – **bizi öz rəhmətinə daxil et.** (وَاَنْتَ اَرْحَمُ الرَّاحِم۪ينَ) – **rəhm edənlərin hamısından artıq rəhm edən sənsən”.**

**152)** (اِنَّ الَّذ۪ينَ اتَّخَذُوا الْعِجْلَ) – (ey Məhəmməd), **həqiqətən, o şəxslər ki buzovu özlərinə məbud etmişdilər,** (سَيَنَالُهُمْ غَضَبٌ مِنْ رَبِّهِمْ) – **əlbəttə, onlara qiyamət günündə öz rəbləri Allah-Təaladan qəzəb yetişər.** (وَذِلَّةٌ فِي الْحَيٰوةِ الدُّنْيَا) – **bu dünyada onlardan ötrü həmişəlik zillət vardır.** (Bu xəbər bu zamana kimi doğru olub, yəhudilərin zəlil olduğu hamıya məlumdur). (وَكَذٰلِكَ نَجْزِي الْمُفْتَر۪ينَ) – **Allah-Təalaya iftira edən şəxslərə belə cəza verərik.**

**153)** (وَالَّذ۪ينَ عَمِلُوا السَّيِّـَٔاتِ) – **o şəxslər ki günah edib,** (ثُمَّ تَابُوا مِنْ بَعْدِهَا وَاٰمَنُوا) – **günahdan sonra da tövbə edib Allah-Təaladan ötrü xalis iman etsələr,** (اِنَّ رَبَّكَ مِنْ بَعْدِهَا لَغَفُورٌ رَح۪يمٌ) – (ey Məhəmməd), **həqiqətən, sənin rəbbin o tövbədən sonra əlbəttə, tövbə edənləri bağışlayıb rəhm edəndir.**

وَلَمَّا سَكَتَ عَنْ مُوسَى الْغَضَبُ اَخَذَ الْاَلْوَاحَ ۚ وَفِي نُسْخَتِهَا هُدًى وَرَحْمَةٌ لِلَّذِينَ هُمْ لِرَبِّهِمْ
يَرْهَبُونَ ﴿١٥٤﴾ وَاخْتَارَ مُوسٰى قَوْمَهُ سَبْعِينَ رَجُلًا لِمِيقَاتِنَا ۚ فَلَمَّآ اَخَذَتْهُمُ الرَّجْفَةُ قَالَ رَبِّ لَوْ
شِئْتَ اَهْلَكْتَهُمْ مِنْ قَبْلُ وَاِيَّايَ ۖ اَتُهْلِكُنَا بِمَا فَعَلَ السُّفَهَآءُ مِنَّا ۚ اِنْ هِيَ اِلَّا فِتْنَتُكَ ۖ تُضِلُّ بِهَا مَنْ تَشَآءُ
وَتَهْدِي مَنْ تَشَآءُ ۚ اَنْتَ وَلِيُّنَا فَاغْفِرْ لَنَا وَارْحَمْنَا وَاَنْتَ خَيْرُ الْغَافِرِينَ ﴿١٥٥﴾ وَاكْتُبْ لَنَا فِي هٰذِهِ
الدُّنْيَا حَسَنَةً وَفِي الْاٰخِرَةِ اِنَّا هُدْنَآ اِلَيْكَ ۖ

---

**154) (وَلَمَّا سَكَتَ عَنْ مُوسَى الْغَضَبُ) – elə ki Musanın hirsi soyudu, (اَخَذَ الْاَلْوَاحَ) – yerə atdığı Tövrat lövhələrini götürdü. (وَفِي نُسْخَتِهَا هُدًى وَرَحْمَةٌ لِلَّذِينَ هُمْ لِرَبِّهِمْ يَرْهَبُونَ) – o lövhələrdə yazılıb qeyd olunan kəlamlarda öz rəbləri Allah-Təaladan qorxan şəxslərdən ötrü haqq tərəfinə hidayət tapıb Allah-Təalanın rəhmətinə qovuşmaq var idi.** (Hz. Musa Tövratdan ötrü Turi-Sinaya gedəndə bəni-İsraildən 70 nəfəri seçib, özüylə ora apardı. Dağa yetişdiklərində, Hz. Musanın duası ilə o 70 nəfər Allah-Təalanın Musa ilə olan danışığını eşitdilər. Hz. Musanın işi bitdikdə, o 70 nəfər dedi: "Allah-Təalanı açıq-aşkar görənə qədər sənə iman gətirmərik". Musa onlara öyüd-nəsihət etsə də, onlar qəbul etmədi. Hz. Musa da Allahdan ona görünməsini istədi, necə ki yuxarıda qeyd olundu. O tələb və sualın dəhşətindən yerdə zəlzələ olub, dağın parçalanmasından o 70 nəfər həlak oldu. Necə ki növbəti ayədə xəbər verilir).

**155) (وَاخْتَارَ مُوسٰى قَوْمَهُ سَبْعِينَ رَجُلًا لِمِيقَاتِنَا) – Musa öz qövmündən 70 nəfər kişini Turi-Sinaya getməkdən ötrü seçdi. (elə ki dağa gəldilər, Allah-Təalanın görünməsini tələb etdilər). (فَلَمَّآ اَخَذَتْهُمُ الرَّجْفَةُ) – Allah-Təalanın görünməsini tələb etdiklərinə görə, elə ki şiddətli zəlzələ onları yaxalayıb, tamamən həlak oldular, (قَالَ رَبِّ) – Musa dedi: "Ey mənim rəbbim, (لَوْ شِئْتَ اَهْلَكْتَهُمْ مِنْ قَبْلُ وَاِيَّايَ) – əgər sən istəsəydin, bu 70 nəfəri və məni də bundan əvvəl həlak edərdin, biz də bu pis günü görməzdik. (اَتُهْلِكُنَا بِمَا فَعَلَ السُّفَهَآءُ مِنَّا) – bu səfehlər cəhalətlərindən sənin görünməni istədikləri üçün bəs məni də onlarla birlikdə həlak edəcəksən? (اِنْ هِيَ اِلَّا فِتْنَتُكَ) – ilahi, bu ancaq sənin fitnən və imtahanındır ki, mənimlə danışdın. Onlar eşidib elə xəyal etdilər ki, səni görmək də olar. O səbəbdən bu pozğun xəyalları ilə sənin görünməyini istədilər. (تُضِلُّ بِهَا مَنْ تَشَآءُ) – bu imtahanla kimi istəsən,** (cahil və nadan olan şəxsləri) **zəlalətə salarsan. (وَتَهْدِي مَنْ تَشَآءُ) – kimə də istəsən,** (alim və arif olan şəxslərə) **hidayət edərsən. (اَنْتَ وَلِيُّنَا) – bizim işlərimizə himayədar olan da sənsən. (فَاغْفِرْ لَنَا وَارْحَمْنَا) – bizi bağışlayıb rəhm et. (وَاَنْتَ خَيْرُ الْغَافِرِينَ) – bağışlayanların ən yaxşısı sənsən.**

**156) (وَاكْتُبْ لَنَا فِي هٰذِهِ الدُّنْيَا حَسَنَةً وَفِي الْاٰخِرَةِ) – ilahi, bizdən ötrü bu dünyada hər bir işimizin gözəl hasil olmasını, axirətdə də əzabdan nicat tapıb əcr və savaba yetişməmizi təyin et. (اِنَّا هُدْنَآ اِلَيْكَ) – həqiqətən, biz hidayət**

قَالَ عَذَابِيٓ اُصِيبُ بِهٖ مَنْ اَشَآءُۚ وَرَحْمَتِي وَسِعَتْ كُلَّ شَيْءٍۜ فَسَاَكْتُبُهَا لِلَّذٖينَ يَتَّقُونَ وَيُؤْتُونَ الزَّكٰوةَ
وَالَّذٖينَ هُمْ بِاٰيَاتِنَا يُؤْمِنُونَۚ ﴿١٥٦﴾ اَلَّذٖينَ يَتَّبِعُونَ الرَّسُولَ النَّبِيَّ الْاُمِّيَّ الَّذٖي يَجِدُونَهُ مَكْتُوبًا عِنْدَهُمْ
فِي التَّوْرٰيةِ وَالْاِنْجٖيلِۘ يَاْمُرُهُمْ بِالْمَعْرُوفِ وَيَنْهٰيهُمْ عَنِ الْمُنْكَرِ وَيُحِلُّ لَهُمُ الطَّيِّبَاتِ وَيُحَرِّمُ عَلَيْهِمُ
الْخَبَٓائِثَ وَيَضَعُ عَنْهُمْ اِصْرَهُمْ وَالْاَغْلَالَ الَّتٖي كَانَتْ عَلَيْهِمْۜ فَالَّذٖينَ اٰمَنُوا بِهٖ وَعَزَّرُوهُ وَنَصَرُوهُ وَاتَّبَعُوا
النُّورَ الَّذٖيٓ اُنْزِلَ مَعَهُۙ اُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَۚ ﴿١٥٧﴾ قُلْ يَٓا اَيُّهَا النَّاسُ اِنّٖي رَسُولُ اللّٰهِ اِلَيْكُمْ جَمٖيعًا

---

**tapıb sənin tərəfinə dönmüşük. (قَالَ عَذَابِيٓ اُصِيبُ بِهٖ مَنْ اَشَآءُ) – Allah-Təala buyurdu ki, ey Musa, kimə əməlinə görə əzab etmək istəsəm, əzab edərəm. (وَرَحْمَتِي وَسِعَتْ كُلَّ شَيْءٍ) – amma mənim rəhmətim bütün şeyləri əhatə edibdir. O şəxslər ki onlara əzab edirəm, gör onlar nə qədər asi şəxslərdirlər ki, mənim rəhmətim onlara şamil olunmur.** (فَسَاَكْتُبُهَا لِلَّذٖينَ يَتَّقُونَ وَيُؤْتُونَ الزَّكٰوةَ) **(وَالَّذٖينَ هُمْ بِاٰيَاتِنَا يُؤْمِنُونَ) – o şəxslər ki qorxub zəkat verir və o şəxslər ki bizim tərəfimizdən gələn möcüzələrə və hökmlərə iman gətirir, onlara rəhmətimi yazıb vacib edərəm.**

**157) (اَلَّذٖينَ يَتَّبِعُونَ الرَّسُولَ النَّبِيَّ الْاُمِّيَّ) – ey Musa, müttəqilər o şəxslərdir ki, bundan sonra gələn yazıb-oxuya bilməyən peyğəmbərə** (Hz. Məhəmmədə) **tabe olarlar. (الَّذٖي يَجِدُونَهُ مَكْتُوبًا عِنْدَهُمْ فِي التَّوْرٰيةِ وَالْاِنْجٖيلِ) – o peyğəmbərin xüsusiyyəti budur ki, həm sənə nazil olan Tövratda və həm səndən sonra Hz. İsaya nazil olan İncildə, hər iki kitabda da onun yazılmış olduğunu görərlər. (يَاْمُرُهُمْ بِالْمَعْرُوفِ وَيَنْهٰيهُمْ عَنِ الْمُنْكَرِ) – o peyğəmbərin xüsusiyyəti budur ki, xalqa yaxşı əməlləri əmr edib, pis əməlləri qadağan edər. (وَيُحِلُّ لَهُمُ الطَّيِّبَاتِ) – xalqdan ötrü pak olan şeyləri** (insan təbiətinin adətən bəyəndiyi yeməli şeyləri) **halal edər. (وَيُحَرِّمُ عَلَيْهِمُ الْخَبَٓائِثَ) – xəbis və murdar olan şeyləri** (insan təbiətinin adətən çəkindiyi yeməli şeyləri) **haram edər. (وَيَضَعُ عَنْهُمْ اِصْرَهُمْ وَالْاَغْلَالَ الَّتٖي كَانَتْ عَلَيْهِمْ) – zəncir kimi xalqın başını və çənəsini bir yerə cəm edib hərəkət etməyə qoymayan ağır və məşəqqətli şeyləri** (bəni-İsrailin məsul olduğu şeylər kimi) **onlardan götürər. Onun şəriətində heç bir ağır təklif olmaz.** (Necə ki uca peyğəmbərimiz buyurubdur: “Asan olan bir dinlə göndərilmişəm, amma müsəlmanlar nəfsani arzuları ilə onu nə qədər ağır tətkliflərlə ağırlaşdırırlar”). **(فَالَّذٖينَ اٰمَنُوا بِهٖ) – o şəxslər ki mənim peyğəmbərimə** (Hz. Məhəmmədə) **iman gətirir, (وَعَزَّرُوهُ وَنَصَرُوهُ) – onun düşmənini ondan uzaqlaşdırıb, ona kömək edir, (وَاتَّبَعُوا النُّورَ الَّذٖيٓ اُنْزِلَ مَعَهُ) – ona nazil olan o işıqlığa** (Qurana) **tabe olur, (اُو۬لٰٓئِكَ هُمُ الْمُفْلِحُونَ) – əlbəttə, qiyamət günündə Allah-Təalanın əzabından nicat tapanlar onlardır.**

**158) (قُلْ يَٓا اَيُّهَا النَّاسُ)** – (ey Musa), (Hz. Məhəmmədə) **əmr edərik ki, xalqa de: (اِنّٖي رَسُولُ اللّٰهِ اِلَيْكُمْ جَمٖيعًا) – həqiqətən, mən Allah-Təala tərəfindən sizin hamınıza peyğəmbərəm, bütün insanlığa göndərilmişəm.** (Bu ayə

الَّذي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِۚ لَٓا اِلٰهَ اِلَّا هُوَ يُحْيي وَيُمِيتُۖ فَاٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ النَّبِيِّ الْاُمِّيِّ الَّذي
يُؤْمِنُ بِاللّٰهِ وَكَلِمَاتِهِ وَاتَّبِعُوهُ لَعَلَّكُمْ تَهْتَدُونَ ﴿١٥٨﴾ وَمِنْ قَوْمِ مُوسٰى اُمَّةٌ يَهْدُونَ بِالْحَقِّ وَبِهِ يَعْدِلُونَ
﴿١٥٩﴾ وَقَطَّعْنَاهُمُ اثْنَتَيْ عَشْرَةَ اَسْبَاطًا اُمَمًاۜ وَاَوْحَيْنَٓا اِلٰى مُوسٰٓى اِذِ اسْتَسْقٰيهُ قَوْمُهُٓ اَنِ اضْرِبْ بِعَصَاكَ
الْحَجَرَۚ فَانْبَجَسَتْ مِنْهُ اثْنَتَا عَشْرَةَ عَيْنًاۜ

---

dəlildir ki, Hz. Peyğəmbər bütün dünya əhlinə peyğəmbərdir). **(الَّذي لَهُ مُلْكُ السَّمٰوَاتِ وَالْاَرْضِ) – o Allah-Təalanın peyğəmbəriyəm ki, səmaların və yerin səltənəti və mülkü ona məxsusdur. (لَٓا اِلٰهَ اِلَّا هُوَ) – yeganə olan Allah-Təaladan başqa heç bir haqq olan məbud yoxdur, (يُحْيي وَيُمِيتُ) – öldürər və dirildər, heç bir şəxs ona qarşı çıxa bilməz. (فَاٰمِنُوا بِاللّٰهِ وَرَسُولِهِ النَّبِيِّ الْاُمِّيِّ) – Allah-Təalaya və onun oxuyub-yazmaq bilməyən peyğəmbərinə** (Hz. Məhəmmədə) **iman gətirin, (الَّذي يُؤْمِنُ بِاللّٰهِ وَكَلِمَاتِهِ) – hansı ki o peyğəmbər də Allah-Təalaya və onun tərəfindən gələn kitablara iman gətirir. (وَاتَّبِعُوهُ لَعَلَّكُمْ تَهْتَدُونَ) – o peyğəmbərə** (Hz. Məhəmmədə) **tabe olun, Allah-Təalanın istəyi odur ki, ona tabe olmaqla hidayət tapıb axirətdə əzabdan nicat tapasınız.** (Hz. Peyğəmbərin və ona tabe olanların bəzi xüsusiyyətlərini Allah-Təala Hz. Musaya xəbər vermişdi, onları Hz. Musanın hekayəsi əsnasında bu surədə qeyd etdi. Yəni Allah-Təala burada peyğəmbərə xəbər verdi ki, sənin xəbərini daha əvvəl Hz. Musaya bildirmişəm. Ondan sonra gələn ayələrdə yenə Hz. Musanın hekayəsinə geri döndü).

**159) (وَمِنْ قَوْمِ مُوسٰى اُمَّةٌ يَهْدُونَ بِالْحَقِّ)** – (ey Məhəmməd), **Musanın camaatı – bəni-İsrailin hamısı asi və itaətdən çıxmış deyildi. Hz. Musanın camaatından xalqı haqqın tərəfinə hidayət edən bir dəstə var idi. (وَبِهِ يَعْدِلُونَ) – xalqın arasında hökm etməkdə haqq və ədalət üzrə rəftar edib, heç vaxt zülm etməzdilər.** (Elə ki firon qərq olub, bəni-İsrail də dənizdən nicat tapıb çölə çıxdılar, Allah-Təala Hz. Musaya əmr etdi ki, bəni-İsraili - Yaqubun 12 oğlunun nəslini 12 dəstəyə ayır, bu dəstə o biri dəstənin işinə qarışmasın. Ondan sonra əmr etdi ki, bir dəftər tutub, onlardan hərb etməyə yarayan 20 ilə 50 yaş arasında olanları o dəftərə qeyd etsinlər. Hz. Musa Allah-Təalanın əmrinə əməl edib 20 ilə 50 yaş arasında olanları qeyd etdi, qadın, uşaq, qoca kişilərdən başqa 600 min əsgər toplandı, onlarla Şam tərəfinə getməyə başladılar).

**160) (وَقَطَّعْنَاهُمُ اثْنَتَيْ عَشْرَةَ اَسْبَاطًا) – bəni-İsraili bir-birindən ayırıb, onları 12 qəbiləyə böldük.** (Biyabanda gedirdilər, elə bir yerə çatdılar ki, orada su tapmadılar. Susuzluqları artıb, gəlib Hz. Musadan su istədilər). **(اُمَمًاۜ وَاَوْحَيْنَٓا اِلٰى مُوسٰٓى اِذِ اسْتَسْقٰيهُ قَوْمُهُٓ اَنِ اضْرِبْ بِعَصَاكَ الْحَجَرَ) – o zaman ki bəni-İsrail Hz. Musadan su istədi, vəhy edib Musaya dedik: "Ey Musa, əlində olan əsanı bu daşa vur". (فَانْبَجَسَتْ مِنْهُ اثْنَتَا عَشْرَةَ عَيْنًا) – elə ki Hz. Musa əsanı daşa vurdu, o daşdan bəni-İsrail qəbilələrinin sayı qədər 12 çeşmə su açıldı.** (Hz. Musa hər

قَدْ عَلِمَ كُلُّ اُنَاسٍ مَشْرَبَهُمْۜ وَظَلَّلْنَا عَلَيْهِمُ الْغَمَامَ وَاَنْزَلْنَا عَلَيْهِمُ الْمَنَّ وَالسَّلْوٰىۜ كُلُوا مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْۜ وَمَا ظَلَمُونَا وَلٰكِنْ كَانُوٓا اَنْفُسَهُمْ يَظْلِمُونَ ﴿١٦٠﴾

---

qəbiləyə bir çeşmə ayırdı, necə ki buyurur:) **(قَدْ عَلِمَ كُلُّ اُنَاسٍ مَشْرَبَهُمْ) – həqiqətən, bəni-İsrailin hər bir qəbiləsi Hz. Musanın əmri ilə su içəçəyi çeşməydən agah oldu.** (Allah-Təala bu ayələrdə bəni-İsrailə verdiyi nemətlərini və bəni-İsrailin asi olduğunu bəyan edir). **(وَظَلَّلْنَا عَلَيْهِمُ الْغَمَامَ) – bəni-İsrail biyabanda havanın hərarətindən şikayət etdi. Buludları onlara kölgəlik etdik.** (Allah-Təala onlardan ötrü havanı həmişəlik buludlu etdi ki, havanın hərarətindən xilas olsunlar). **(وَاَنْزَلْنَا عَلَيْهِمُ الْمَنَّ وَالسَّلْوٰى) – Misirdən gətirdikləri azuqə qurtaranda, onlara qüdrət halvası və bildirçin yeməyi göndərdik.** (Bu əhvalat Bəqərə surəsinin 57-ci ayəsində qeyd olunubdur)**. (كُلُوا مِنْ طَيِّبَاتِ مَا رَزَقْنَاكُمْ) – bəni-İsrailə dedik: "Allah-Təalanın pak olan ruzilərindən yeyib Allah-Təalaya şükür edin,** (amma bəni-İsrail şükür etmək əvəzinə nankorluq edib özlərinə zülm etdilər)**. (وَمَا ظَلَمُونَا)** – (ey Məhəmməd)**, bəni-İsrail bu nankorluqları ilə bizə zülm etmədilər. (وَلٰكِنْ كَانُوٓا اَنْفُسَهُمْ يَظْلِمُونَ) – lakin özlərinə * zülm etmiş oldular.**

*(****Qeyd:** *Nankorluq edən şəxs özünə zülm etmiş olar. Zalım şəxsə isə nicat yoxdur. Nankorluğun mənası - Allah-Təalanın verdiyi neməti lazım olmadığı yerdə istifadə etmək, lazım olduğu yerdə istifadə etməkdən çəkinməkdir. Allah-Təala dünyada bol nemət, var-dövlət bəxş etdiyi şəxslərə əmr etmir ki, bu var-dövləti toplayıb, bağlı kassalarda, keşikçi nəzarətində qoruyub saxlayın, əksinə əmr edir ki, Allah-Təalanın yolunda müsəlmanların faydası üçün sərf edin. Var-dövlət sahibi olan şəxs Allah-Təalanın verdiyi neməti Onun istədiyi yerdə sərf etməsə, o şəxs nankor olar. Belə zalıma nicat yoxdur. Varlı müsəlman şəxs necə razı olur ki, müsəlmanların 100 cür ehtiyacı olduğu halda, o, müsəlmanların ehtiyaclarından birini həll etməsin? Belə şəxsə müsəlman demək olarmı? Bəs onlar özlərindən əvvəlki müsəlmanların əsərlərinə baxıb düşünmürlər ki, onlar necə mədrəsələr, qocalar və yetimlər evləri, istirahət evləri, xəstəxanalar və böyük məscidlər tikiblər? Və onlardan ötrü vəqflər də yaradıblar ki, onların xərclikləri əskik olmasın və müsəlmanlar da onlardan məhrum və məhv olmasınlar. Bizim bu dövrdəki güclü şəxslər - əksəriyyəti də üləmadır - xüsusən, islam dünyasının müəyyən bölgələrində yaşayanlar o cür binalar tikmək əvəzinə, o qədim binaların vəqflərini ələ keçirib, özlərinə mülk ediblər, əsası təqva ilə qoyulan o binalar da tamamən xarab və məhv olubdur. İslam məmləkətlərini gəzib səyahət edən şəxslər bu mətləblərdən xəbərdardırlar. Bizim zəmanəmizdə Qarun kimi çox varlı şəxslər var ki, xəzinələr yığıb toplayıblar, lakin din və millətin tərəqqisi üçün bir xeyir əməl etmirlər. Ey Allahım, böyük bəlaya düçar olmuşuq, ilahi, müsəlmanların rəhbərlərinə bir bəsirət bəxş et. Bəs Allah-Təala Qurani-Şərifdə millət yolunda sərf etmək üçün zəkatı (malın 40-da birini) vacib etməyib? Quranı tərk edib, zəkata mane olan şəxs necə öz adını müsəlman qoyub, özünü müsəlman saya bilər? Bəli, zəkatı an-*

وَاِذْ قِيلَ لَهُمُ اسْكُنُوا هٰذِهِ الْقَرْيَةَ وَكُلُوا مِنْهَا حَيْثُ شِئْتُمْ وَقُولُوا حِطَّةٌ وَادْخُلُوا الْبَابَ سُجَّدًا
نَغْفِرْ لَكُمْ خَطِيٓـَٔاتِكُمْ ۜ سَنَزِيدُ الْمُحْسِنِينَ ﴿١٦١﴾ فَبَدَّلَ الَّذِينَ ظَلَمُوا مِنْهُمْ قَوْلًا غَيْرَ الَّذِي قِيلَ
لَهُمْ فَاَرْسَلْنَا عَلَيْهِمْ رِجْزًا مِنَ السَّمَٓاءِ بِمَا كَانُوا يَظْلِمُونَ ۟﴿١٦٢﴾ وَسْـَٔلْهُمْ عَنِ الْقَرْيَةِ الَّتِي كَانَتْ
حَاضِرَةَ الْبَحْرِۢ اِذْ يَعْدُونَ فِي السَّبْتِ اِذْ تَأْتِيهِمْ حِيتَانُهُمْ يَوْمَ سَبْتِهِمْ شُرَّعًا وَيَوْمَ لَا يَسْبِتُونَۙ لَا تَأْتِيهِمْ ۚ
كَذٰلِكَ نَبْلُوهُمْ بِمَا كَانُوا يَفْسُقُونَ ﴿١٦٣﴾

---

*caq əkinçilərə vacib ediblər. Özlərinə isə zəkatı vacib saymırlar. Üləmalar da onların rəyinə mane olmayıb onların xeyri üçün hiylələr quraşdırırlar).*

**161) (وَاِذْ قِيلَ لَهُمُ اسْكُنُوا هٰذِهِ الْقَرْيَةَ)** – (yadınıza salın)**, o zaman ki bəni-İsrailə dedik: "Bu şəhərdə** (Beytül-müqəddəs olan şəhərdə) **sakin olun, (وَكُلُوا مِنْهَا حَيْثُ شِئْتُمْ) – onda olan meyvələrdən istədiyiniz yerdə yeyin. (وَقُولُوا حِطَّةٌ) – ibadət çadırına daxil olanda deyin: "İlahi, bizim günahlarımızı bağışla". (وَادْخُلُوا الْبَابَ سُجَّدًا) – ibadət çadırının qapısından daxil olanda səcdə edən halda daxil olun. (نَغْفِرْ لَكُمْ خَطِيٓـَٔاتِكُمْ)** – (siz bu əməlləri edin)**, biz də sizin xətalarınızı bağışlayarıq. (سَنَزِيدُ الْمُحْسِنِينَ) – yaxşı əməl sahiblərinin dərəcələrini də axirətdə artırarıq".**

**162) (فَبَدَّلَ الَّذِينَ ظَلَمُوا مِنْهُمْ قَوْلًا غَيْرَ الَّذِي قِيلَ لَهُمْ) – ibadət çadırına daxil olanda bəni-İsraildən zalım olan şəxslər bağışlanmaq əvəzinə başqa mənasız sözlər deyib, səcdə etmirdilər. (فَاَرْسَلْنَا عَلَيْهِمْ رِجْزًا مِنَ السَّمَٓاءِ بِمَا كَانُوا يَظْلِمُونَ) – bu zülmləri səbəbi ilə onlara səma tərəfindən pis bir bəla – taun göndərdik.** (Allah-Təala ibadətxananın ehtiramına riayət etmədiklərinə görə, onlara taun göndərib 24 min nəfəri həlak etdiyini buyurur).

**163) (وَسْـَٔلْهُمْ عَنِ الْقَرْيَةِ الَّتِي كَانَتْ حَاضِرَةَ الْبَحْرِۢ)** – (ey Məhəmməd)**, bu yəhudilərdən dəniz kənarında yerləşən o qəsəbənin əhvalatını soruş. Onlar o qəsəbənin əhvalatını bilirlər, kitablarında qeyd olunubdur, baxıb görsünlər, sən ki oxuyan deyilsən, bu xəbərlərdən necə agah olubsan? Bir də sənə məlum olsun ki, bu yəhudilər qədim zamandan bəri küfr və zəlalətdə olub həmişə Allah-Təalanın qoyduğu həddi aşıblar. (اِذْ يَعْدُونَ فِي السَّبْتِ) – o zaman o yəhudilər şənbə gününün ehtiramını pozdular, şənbə günündə balıq ovladılar, halbuki o gün ov etməkdən qadağan olunmuşdular. (اِذْ تَأْتِيهِمْ حِيتَانُهُمْ يَوْمَ سَبْتِهِمْ شُرَّعًا) – o zaman şənbə günlərində suyun üzündə açıq-aşkar xeyli çox balıq onlara gələrdi, (وَيَوْمَ لَا يَسْبِتُونَۙ لَا تَأْتِيهِمْ) – amma şənbə olmayanda onlara balıq gəlməzdi.** (elə ki gördülər, şənbə günündə balıq çox gəlir, özgə günlərdə gəlmir, şənbə gününün ehtiramını pozub balıqları o gün ovlamağa başladılar). **(كَذٰلِكَ نَبْلُوهُمْ بِمَا كَانُوا يَفْسُقُونَ) – habelə onları möhlət və bəlaya düçar etdik, çünki fasiq olub Allah-Təalanın qoyduğu həddi aşmışdılar.**

وَاِذْ قَالَتْ اُمَّةٌ مِنْهُمْ لِمَ تَعِظُونَ قَوْمًاۙ اللّٰهُ مُهْلِكُهُمْ اَوْ مُعَذِّبُهُمْ عَذَابًا شَدِيدًاۜ قَالُوا مَعْذِرَةً اِلٰى رَبِّكُمْ وَلَعَلَّهُمْ يَتَّقُونَ ﴿١٦٤﴾ فَلَمَّا نَسُوا مَا ذُكِّرُوا بِهٖٓ اَنْجَيْنَا الَّذِينَ يَنْهَوْنَ عَنِ السُّوٓءِ وَاَخَذْنَا الَّذِينَ ظَلَمُوا بِعَذَابٍ بَٔيٖسٍ بِمَا كَانُوا يَفْسُقُونَ ﴿١٦٥﴾ فَلَمَّا عَتَوْا عَنْ مَا نُهُوا عَنْهُ قُلْنَا لَهُمْ كُونُوا قِرَدَةً خَاسِئٖينَ ﴿١٦٦﴾ وَاِذْ تَاَذَّنَ رَبُّكَ لَيَبْعَثَنَّ عَلَيْهِمْ اِلٰى يَوْمِ الْقِيٰمَةِ مَنْ يَسُومُهُمْ سُوٓءَ الْعَذَابِۜ اِنَّ رَبَّكَ لَسَرِيعُ الْعِقَابِۚ

---

**164) (وَاِذْ قَالَتْ اُمَّةٌ مِنْهُمْ) – bəni-İsrail arasında onlara öyüd-nəsihət edən mömin bir camaat var idi. Onların bir qismi gördülər ki, bəni-İsrailə nəsihət təsir etmir, nəsihət verməyi tərk etdilər, bir qismi isə öyüd-nəsihət etməyi tərk etməyib möhkəm durdular, necə ki buyurur: o zaman ki nəsihət etməyi tərk edənlər bəni-İsrailin nəsihət edən möminlərinə dedilər: "(لِمَ تَعِظُونَ قَوْمًاۙ اللّٰهُ مُهْلِكُهُمْ اَوْ مُعَذِّبُهُمْ عَذَابًا شَدِيدًا) –Allah-Təalanın** (şənbə gününün ehtiramını pozduqları üçün) **həlak edəcəyi, ya da uzun şiddətli əzab göndərəcəyi bir camaata niyə nəsihət edirsiniz?" (قَالُوا مَعْذِرَةً اِلٰى رَبِّكُمْ) – nəsihət edənlər dedilər: "Biz o səbəbdən nəsihət edirik ki, qiyamət günündə sizin rəbbiniz Allah-Təalaya qarşı üzrxahlığımız olsun ki, biz nəsihət etdik, onlar qəbul etmədilər. (وَلَعَلَّهُمْ يَتَّقُونَ) – bir də bəlkə, nəsihət səbəbinə Allah-Təaladan qorxub pis əməlləri tərk etsinlər".**

**165) (فَلَمَّا نَسُوا مَا ذُكِّرُوا بِهٖٓ ) – asi olan yəhudilər onlara edilən öyüd-nəsihəti unutduqları zaman, (اَنْجَيْنَا الَّذِينَ يَنْهَوْنَ عَنِ السُّوٓءِ) – onlara əzab nazil etdik, onlara öyüd-nəsihət edənlərə isə o əzabdan nicat verdik. (وَاَخَذْنَا الَّذِينَ ظَلَمُوا بِعَذَابٍ بَٔيٖسٍ بِمَا كَانُوا يَفْسُقُونَ) – Allah-Təalanın itaətindən çıxıb fasiq olduqları üçün o zalımları şiddətli olan əzaba düçar etdik.** (Bu əzab həlak etmə əzabı deyildi, ibrət alıb küfrdən dönmələri üçün idi).

**166) (فَلَمَّا عَتَوْا عَنْ مَا نُهُوا عَنْهُ) –bəni-İsrail asilik edib qadağan olunan şeylərdən vaz keçmədiklərində, (قُلْنَا لَهُمْ كُونُوا قِرَدَةً خَاسِئٖينَ) – o camaata dedik və əmr etdik ki, Allah-Təalanın rəhmətindən uzaq olduğunuz halda, meymun surətinə daxil olun,** (Allah-Təalanın əmri ilə tamamən meymun olub, 3 gün elə qalıb, ondan sonra hamısı həlak oldu. Meymun surətinə daxil olmağın təhqiqi Bəqərə surəsinin 65 və 66-cı ayələrinin təfsirində keçdi. O ayələrə baxılsın).

**167) (وَاِذْ تَاَذَّنَ رَبُّكَ)** – (ey Məhəmməd), **o zamanı** (Hz. Musa dövrünü) **yadına sal ki, sənin rəbbin Allah-Təala onda Hz. Musaya xəbər verdi ki, (لَيَبْعَثَنَّ عَلَيْهِمْ اِلٰى يَوْمِ الْقِيٰمَةِ مَنْ يَسُومُهُمْ سُوٓءَ الْعَذَابِ)** – (ey Musa), **Allah bəni-İsrailin qəbih əməllərinə görə, onlara əzab edəcək şəxsləri qiyamət günənədək onlara hakim edər. (Bu xəbər bu zamana kimi doğru olub, yəhudilər hər bir yerdə əzab içindədirlər). (اِنَّ رَبَّكَ لَسَرِيعُ الْعِقَابِۚ)** – (ey Məhəmməd), **həqiqətən,**

وَاِنَّهُ لَغَفُورٌ رَحِيمٌ ﴿١٦٧﴾ وَقَطَّعْنَاهُمْ فِي الْاَرْضِ اُمَمًاۚ مِنْهُمُ الصَّالِحُونَ وَمِنْهُمْ دُونَ ذٰلِكَ ۘ
وَبَلَوْنَاهُمْ بِالْحَسَنَاتِ وَالسَّيِّاٰتِ لَعَلَّهُمْ يَرْجِعُونَ ﴿١٦٨﴾ فَخَلَفَ مِنْ بَعْدِهِمْ خَلْفٌ وَرِثُوا الْكِتَابَ
يَاْخُذُونَ عَرَضَ هٰذَا الْاَدْنٰى وَيَقُولُونَ سَيُغْفَرُ لَنَاۚ وَاِنْ يَاْتِهِمْ عَرَضٌ مِثْلُهُ يَاْخُذُوهُۜ

---

**sənin rəbbin Allah-Təala asilərə sürətlə əzab edəndir.** (وَاِنَّهُ لَغَفُورٌ رَحِيمٌ) – **əlbəttə, həqiqətən, tövbə edənləri bağışlayıb onlara rəhm edəndir.**

**168)** (وَقَطَّعْنَاهُمْ فِي الْاَرْضِ اُمَمًاۚ) – (ey Məhəmməd)**, yəhudiləri yer üzündə parça-parça dəstələrə ayırdıq ki, onlardan hər bir dəstə bir şəhərdə, ya da bir qəsəbədə olub, gərək, bir yerə cəm olmayıb, ittifaqları olmasın. (Bu xəbərin doğruluğu bizim bu zəmanəmizədək zahir və aşkardır, bəs bu xəbərlər bizim peyğəmbərimizin doğruluğuna dəlil olmaqda kifayət etməzmi?)** (مِنْهُمُ الصَّالِحُونَ) – **yəhudilərdən bəzisi saleh və mömin şəxslər idi.** (وَمِنْهُمْ دُونَ ذٰلِكَ) – **onlardan bəzisi də imandan uzaq, kafir və fasiq idi.** (وَبَلَوْنَاهُمْ بِالْحَسَنَاتِ وَالسَّيِّاٰتِ) – **onları bəzən bol nemətlərə, bəzən də sıxıntıya və bəzi müsibətlərə düçar etdik ki,** (لَعَلَّهُمْ يَرْجِعُونَ) – **bəlkə, tövbə edib, Allah-Təala tərəfinə qayıtsınlar.**

**169)** (فَخَلَفَ مِنْ بَعْدِهِمْ خَلْفٌ وَرِثُوا الْكِتَابَ) – (ey Məhəmməd)**, əvvəlki yəhudilərə və Tövrata sənin zamanında olan bu yəhudilər varis oldular.** (يَاْخُذُونَ عَرَضَ هٰذَا الْاَدْنٰى) – **onların alimləri bu əskik və dəyərsiz olan dünya malından alıb Tövratın hökmlərini* dəyişdirdilər ki, avam insanlar üçün asan olub, onlara meyil etsinlər.**

*(***Qeyd:** Hərçənd bu sözlər zahirdə yəhudi alimləri haqqındadır, amma əslində məqsəd biz müsəlmanları agah etməkdir ki, "bu qiymətsiz və əskik dünya malını alırlar", zərb-məsəldə deyilir: "Qızım, sənə deyirəm, gəlinim, sən eşit". Bu ayələr də bunun kimidir. Nə çox Quran ehkamı dəyişdirilib, onun əvəzinə xurafat sözlər müsəlmanlar rəvac tapıbdır. Əgər Qurani-Şərifin ehkamı dəyişdirilməyibsə, bəs müsəlmanlar arasındakı bu ixtilaf hardandır? Qurani-Şərifin ehkamında ixtilaf olmaz, bu ixtilaflar Quranın ehkamını dəyişdirib, uydurma xəbərlərə bağlanmaqdan meydana gəlibdir. Bəs bu mətləbi inkar edib günəşi gizləmək mümkünmü? Allah-Təalanın sözü haqq və doğrudur. Necə ki buyurur: "Allah-Təalanın hökmünü dəyişdirib, lakin özlərini müqəssir hesab etmirlər". Biz islam üləmalarının əhvalı da belədir, Quranın açıq-aşkar hökmünü deyən adama xəta isnad edib, küfrünə hökm edərlər, Quranın nə çox hökmü gizlin qalıb, onu aşkar edəni dinsiz və zındıq hesab edirlər. Burunları yerdə sürtülsün. Amma yenə də həqiqəti bəyan etmək lazımdır, ağıllı şəxslər gərək bu kitabdakı ayələrin mənasına diqqətlə baxsın. O ayələrlə bizim əməllərimizi müqayisə edəndə, müsəlmanların əməllərinin Qurani-Şəriflə müxalif olduğu aşkar olar. İlahi, zalımların şərindən bizi mühafizə et).*

(وَيَقُولُونَ سَيُغْفَرُ لَنَا) – **və deyirlər: "Allah-Təala bizi bağışlayıb azarlamaz".** (وَاِنْ يَاْتِهِمْ عَرَضٌ مِثْلُهُ يَاْخُذُوهُ) – **halbuki əvvəlki** (yəhudilərin) **aldıqları rüşvətin eyni-**

اَلَمْ يُؤْخَذْ عَلَيْهِمْ مِيثَاقُ الْكِتَابِ اَنْ لَا يَقُولُوا عَلَى اللّٰهِ اِلَّا الْحَقَّ وَدَرَسُوا مَا فِيهِۜ وَالدَّارُ الْاٰخِرَةُ خَيْرٌ لِلَّذِينَ يَتَّقُونَۜ اَفَلَا تَعْقِلُونَ﴿١٦٩﴾ وَالَّذِينَ يُمَسِّكُونَ بِالْكِتَابِ وَاَقَامُوا الصَّلٰوةَۜ اِنَّا لَا نُضِيعُ اَجْرَ الْمُصْلِحِينَ﴿١٧٠﴾ وَاِذْ نَتَقْنَا الْجَبَلَ فَوْقَهُمْ كَاَنَّهُ ظُلَّةٌ وَظَنُّوا اَنَّهُ وَاقِعٌ بِهِمْۚ خُذُوا مَا اٰتَيْنَاكُمْ بِقُوَّةٍ وَاذْكُرُوا مَا فِيهِ لَعَلَّكُمْ تَتَّقُونَ۟﴿١٧١﴾

---

**si onlara gəlsə, yenə o rüşvəti alıb Tövratın hökmünü dəyişdirərlər, bununla belə, necə deyirlər ki, Allah-Təala bizi bağışlayar.** (اَلَمْ يُؤْخَذْ عَلَيْهِمْ مِيثَاقُ الْكِتَابِ اَنْ لَا يَقُولُوا عَلَى اللّٰهِ اِلَّا الْحَقَّ) – **bu sözü necə deyərlər? Bəs Tövratda onlardan əhd alınmayıbdır ki, haqq olan sözdən başqasını Allah-Təalaya isnad etməsinlər?** (Görəsən, haqq, Allah-Təalanın haqq olan sözünü dəyişdirib, onun əvəzinə avam insanların ürəyincə olan sözləri deməkdir?) **(وَدَرَسُوا مَا فِيهِ) – halbuki özləri Tövratın hökmlərini oxuyurlar ki, Allah-Təala günahkara əzab edər və bağışlanmağın şərti günahdan tövbə etməkdir. Bunlar tövbəsiz necə deyərlər ki, Allah-Təala bizi bağışlayacaqdır.** (وَالدَّارُ الْاٰخِرَةُ خَيْرٌ لِلَّذِينَ يَتَّقُونَ) – **axirət evi o şəxslərdən ötrüdür ki, Allah-Təalanın hökmünü dəyişdirib rüşvət almaqdan qorxsunlar, bu, dünya evindən yaxşıdır, (اَفَلَا تَعْقِلُونَ) – bəs ağılla rəftar edib, fikirləşmirsiniz ki, dünyanın əvəzinə axirəti satmaq olmaz?**

**170) (وَالَّذِينَ يُمَسِّكُونَ بِالْكِتَابِ) – o şəxslər ki Allah-Təalanın kitabına möhkəm yapışıb itaət edir, (وَاَقَامُوا الصَّلٰوةَ) – və namaz qılıb, onu tərk etmir,** (Allah-Təalanın kitabı ilə əməl etməyi əmr edib, ondan sonra bütün ibadətlərin arasından təkcə namazı zikr etmək namazın fəzilətinə böyük dəlildir. Namaz dinin sütunudur, küfr ilə iman arasında fərqin əlamətidir). **(اِنَّا لَا نُضِيعُ اَجْرَ الْمُصْلِحِينَ) – həqiqətən, biz saleh əməl edən o şəxslərin əcrlərini puç etmərik.**

**171) (وَاِذْ نَتَقْنَا الْجَبَلَ فَوْقَهُمْ كَاَنَّهُ ظُلَّةٌ)** – (bəni-İsrail Tövratın ehkamını qəbul etməyib Hz. Musaya itaət etmədi, o səbəbdən Allah-Təala buyurur: “Ey Məhəmməd, yadına sal ki), **Turi-Sina dağını bəni-İsrailin başının üstündə elə ucaltdıq ki, sanki, onların başının üstündə bulud kimi kölgə salan bir şey idi, (وَظَنُّوا اَنَّهُ وَاقِعٌ بِهِمْ) – o dağa başlarının üstündə baxıb güman etdilər ki, onların üstünə düşəcəkdir. (خُذُوا مَا اٰتَيْنَاكُمْ بِقُوَّةٍ) – onları qorxudub dedik: “Sizə verdiyimiz Tövratın hökmlərini qəbul edib, əzmlə çalışın ki, onun məşəqqətli olan əmrlərinə əməl edəsiniz. (وَاذْكُرُوا مَا فِيهِ) – Tövratın hökmlərini zikr edib, ehtiyac məqamında əməl edin. (لَعَلَّكُمْ تَتَّقُونَ) – əlbəttə, gərək qorxub, Allah-Təalaya asi olmağı tərk edəsiniz.** (Turi-Sinanın əhvalatı və onların başının üstünə necə qaldırılması Bəqərə surəsinin 63-cü ayəsində qeyd olundu).

وَاِذْ اَخَذَ رَبُّكَ مِنْ بَنٖٓي اٰدَمَ مِنْ ظُهُورِهِمْ ذُرِّيَّتَهُمْ وَاَشْهَدَهُمْ عَلٰٓى اَنْفُسِهِمْۚ اَلَسْتُ بِرَبِّكُمْۜ قَالُوا بَلٰىۚ شَهِدْنَاۚ اَنْ تَقُولُوا يَوْمَ الْقِيٰمَةِ اِنَّا كُنَّا عَنْ هٰذَا غَافِلٖينَۙ ﴿١٧٢﴾ اَوْ تَقُولُوٓا اِنَّمَٓا اَشْرَكَ اٰبَٓاؤُ۬نَا مِنْ قَبْلُ وَكُنَّا ذُرِّيَّةً مِنْ بَعْدِهِمْۚ اَفَتُهْلِكُنَا بِمَا فَعَلَ الْمُبْطِلُونَ ﴿١٧٣﴾

---

**172) (وَاِذْ اَخَذَ رَبُّكَ مِنْ بَنٖٓي اٰدَمَ مِنْ ظُهُورِهِمْ ذُرِّيَّتَهُمْ)** – (ey Məhəmməd)**, o zaman ki sənin rəbbin keçmiş yəhudilərin belindən onların övladlarını** (sənin dövründəki yəhudiləri) **çıxarıb dünyaya gətirdi,* (وَاَشْهَدَهُمْ عَلٰٓى اَنْفُسِهِمْ)** – (ey Məhəmməd)**, sənin zamanında olan yəhudiləri rəbbin Allah-Təala sağ qoyub onları özlərinə şahid tutub, (اَلَسْتُ بِرَبِّكُمْ) – onlardan soruşdu: "Ey yəhudilər, bəs mən sizin rəbbiniz deyiləm?" (قَالُوا بَلٰى شَهِدْنَا) – yəhudilər dedilər: "Şəhadət etdik ki, sən bizim rəbbimizsən, (amma ey Məhəmməd, bununla belə, sənə iman gətirmədilər), (Allah-Təalanın bu kəlamı bir məsəldir, Allah-Təala insan ağlına özünün haqq olması haqda dəlillər verib, insanlar, gərək, fikir verib, ağıla əsaslanıb, Allah-Təalanın haqq olduğunu dərk etsinlər. Allah-Təala ağıl səbəbinə onlardan şəhadət alıb, onlar da Allah-Təalanın haqq olmasına ağıllarında olan dəlillərlə şəhadət etdilər, bir də insanların varlığı Allah-Təalanın varlığına şəhadətdir). (اَنْ تَقُولُوا يَوْمَ الْقِيٰمَةِ)** – (ey yəhudilər)**, sizə ağıl verib, ağlınıza aşkar dəlillər qoyduq ki, qiyamət günündə deməyəsiniz ki, (اِنَّا كُنَّا عَنْ هٰذَا غَافِلٖينَ) – həqiqətən, biz dünyada Allah-Təalanın haqq olmasından qafil idik.** (Allah-Təala insana ağıl bəxş edəndən sonra onların bu üzrxahlığı qəbul edilən deyildir)**.**

*(****Qeyd:*** *Ayədəki yəhudilərdən məqsəd Hz. Məhəmmədən (ə.s) əvvəlki yəhudilərdir və onların nəslindən məqsəd də Hz. Peyğəmbərin zamanındakı yəhudilərdir. Təfsirçilərin əksəriyyəti bu ayənin təfsirində yazıblar ki, Allah-Təala qiyamətədək olan insanları Adəm övladının belindən qarışqa surətində çıxarıb, onlardan əhd aldı ki, Allah-Təalaya itaət edib ona şərik qoşmasınlar. Bunun adına zərrə əhvalatı deyiblər. Bu barədə çox müfəssəl izahlar veriblər, mən həqir müxtəsər şəkildə qeyd etdim. Bunların hamısı mənasız sözlərdir. Birincisi, Allah-Təala Adəmin belindən yox, Adəm övladının belindən onların övladlarını çıxartdıq deyir. Yəni onların nəslindən övlad dünyaya gətirdik. Bu sözün Adəmə dəxli yoxdur və ikincisi, bəni-Adəmdən məqsəd yəhudilərdir, bunun dəlili də həmin ayənin yəhudilərin əhvalatından bəhs edən ayələrin yanında olmasıdır. Bir az təfəkkür edilsə, mənim sözümün haqq olduğu aşkar olar. Əksər təfsirçilərin dediyi sözlər ayədən heç bir şəkildə anlaşılmır. Əksinə, Allah-Təala insana ağıl bəxş etməklə onlardan əhd alıbdır ki, müvəhhid olub onun tövhidinə inansınlar. Daha qarışqa surətində onları təsvir etmək lazım deyildir).*

**173) (اَوْ تَقُولُوٓا اِنَّمَٓا اَشْرَكَ اٰبَٓاؤُ۬نَا مِنْ قَبْلُ) – ya da deməyəsiniz ki, həqiqətən, bizim ata-babalarımız bundan əvvəl Allah-Təalaya şərik qoşublar, (وَكُنَّا ذُرِّيَّةً مِنْ بَعْدِهِمْ) – biz də onların övladı olub onlara təqlid etmişik. Təqsir bizdə deyil, bəlkə, təqsir bizim ata-babalarımızdadır. (اَفَتُهْلِكُنَا بِمَا فَعَلَ الْمُبْطِلُونَ) – ey Al-**

وَكَذٰلِكَ نُفَصِّلُ الْاٰيَاتِ وَلَعَلَّهُمْ يَرْجِعُونَ ﴿١٧٤﴾ وَاتْلُ عَلَيْهِمْ نَبَاَ الَّذِيٓ اٰتَيْنَاهُ اٰيَاتِنَا فَانْسَلَخَ مِنْهَا
فَاَتْبَعَهُ الشَّيْطَانُ فَكَانَ مِنَ الْغَاوِينَ ﴿١٧٥﴾ وَلَوْ شِئْنَا لَرَفَعْنَاهُ بِهَا وَلٰكِنَّهُ اَخْلَدَ اِلَى الْاَرْضِ وَاتَّبَعَ
هَوٰيهُۚ فَمَثَلُهُ كَمَثَلِ الْكَلْبِۚ اِنْ تَحْمِلْ عَلَيْهِ يَلْهَثْ اَوْ تَتْرُكْهُ يَلْهَثْۜ ذٰلِكَ مَثَلُ الْقَوْمِ الَّذِينَ كَذَّبُوا
بِاٰيَاتِنَاۚ فَاقْصُصِ الْقَصَصَ لَعَلَّهُمْ يَتَفَكَّرُونَ﴿١٧٦﴾

---

**lahım, bizdən qabaq gəlib-keçən ata-babalarımızın batil əməllərinə görə, bizi də həlak edirsən? Biz onları təqlid edib tabe olmuşuq. Təqsir bizdə deyil.** (Onlara ağıl verdik ki, qiyamət günündə bu sözləri deyə bilməsinlər. Əgər desələr, onlardan qəbul olunmaz. Çünki dəlil və sübut, olan yerdə heç bir şəxsin üzrxahlığı qəbul edilməz).

**174) (وَكَذٰلِكَ) – necə ki qeyd olundu, (نُفَصِّلُ الْاٰيَاتِ) – bizim haqq və mövcud olmağımıza işarə edən dəlilləri yəhudilərdən ötrü müfəssəl izah edib bəyan edərik. (وَلَعَلَّهُمْ يَرْجِعُونَ) – əlbəttə, dəlil səbəbinə gərək şirkdən dönüb, vəhdaniyyət tərəfinə qayıtsınlar.**

**175) (وَاتْلُ عَلَيهِمْ نَبَاَ الَّذِيٓ اٰتَيْنَاهُ اٰيَاتِنَا)** – (ey Məhəmməd)**, yəhudilərə o şəxsin xəbərini oxu ki, ona öz elm və hikmətimizi vermişdik. (فَانْسَلَخَ مِنْهَا) – o elmlərdən uzaq olub onları inkar etdi. (فَاَتْبَعَهُ الشَّيْطَانُ) – şeytan onu özünə tabe edib, (فَكَانَ مِنَ الْغَاوِينَ) – haqq yolunda asi şəxslərdən oldu.** (Kənan əhlindən Bəl`am ibn Baura böyük elm sahibi idi. Mərifət və tövhid elmində kamil bir şəxs idi. Hz. Musa onların məkanına gəlib, insanları Allah-Təalanın dininə dəvət etdi, onlar (Bəl`amın) yanına gəlib dedilər: "Sən alim və arif bir şəxssən, dua et ki Musa özü və qövmü həlak olsun". Bəl`am dedi: "Musa haqq olan peyğəmbərdir, mən ona necə belə dua edim?" Camaat israr edib axırda onu yoldan çıxartdılar. Musaya və onun qövmünə bəd dua edib kafir oldu. Elə ki bəd dua etdi, onun dili ağzından çıxıb, köpək dili kimi sinəsinə sallandı).

**176) (وَلَوْ شِئْنَا لَرَفَعْنَاهُ بِهَا) – əgər biz istəsəydik,** (Bəl`amın) **mərtəbəsini elm və hikmət səbəbinə ucaldıb, onu saleh şəxslərə qoşardıq. (وَلٰكِنَّهُ اَخْلَدَ اِلَى الْاَرْضِ) – lakin** (Bəl`am öz əməlinin səbəbinə) **dünyaya meyil edib** (dünyanı axirətdən üstün tutdu)**. (وَاتَّبَعَ هَوٰيهُۚ) – o, nəfsani arzusuna tabe olub Allah-Təalanın əmrini kənara qoydu. (فَمَثَلُهُ كَمَثَلِ الْكَلْبِ) – onun məsəli it məsəli kimidir. (اِنْ تَحْمِلْ عَلَيْهِ يَلْهَثْ) – itin sənəti budur ki, əgər ona həmlə etsən, dilini çıxarıb ləhləyər. (اَوْ تَتْرُكْهُ يَلْهَثْ) – onu tərk də etsən, yenə ləhləyər. (ذٰلِكَ مَثَلُ الْقَوْمِ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَاۚ) – bu məsəl bizim ayələrimizi təkzib edən camaatın məsəlidir.** (Ey Məhəmməd, bu yəhudilər Quranı təkzib edib sənə iman gətirmədilər, necə ki Bəl`am Musanı təkzib edib iman gətirmədi. Haqqı təkzib edənlərin məsəli o itin məsəli kimidir). **(فَاقْصُصِ الْقَصَصَ)** – (ey Məhəmməd)**, bu yəhudilərdən ötrü Bəl`am qissəsi kimi qissələr danış. (لَعَلَّهُمْ يَتَفَكَّرُونَ) – əlbəttə, gərək, onlar təfəkkür edib və işin sonundan çəkinib, iman gətirsinlər.**

سَآءَ مَثَلًا الْقَوْمُ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا وَاَنْفُسَهُمْ كَانُوا يَظْلِمُونَ ﴿١٧٧﴾ مَنْ يَهْدِ اللّٰهُ فَهُوَ الْمُهْتَدِيۚ
وَمَنْ يُضْلِلْ فَاُولٰئِكَ هُمُ الْخَاسِرُونَ﴿١٧٨﴾ وَلَقَدْ ذَرَأْنَا لِجَهَنَّمَ كَثِيرًا مِنَ الْجِنِّ وَالْاِنْسِۘ لَهُمْ
قُلُوبٌ لَا يَفْقَهُونَ بِهَاۘ وَلَهُمْ اَعْيُنٌ لَا يُبْصِرُونَ بِهَاۘ وَلَهُمْ اٰذَانٌ لَا يَسْمَعُونَ بِهَاۜ اُولٰٓئِكَ كَالْاَنْعَامِ
بَلْ هُمْ اَضَلُّ ۘ اُولٰئِكَ هُمُ الْغَافِلُونَ ﴿١٧٩﴾ وَلِلّٰهِ الْاَسْمَآءُ الْحُسْنٰى فَادْعُوهُ بِهَاۖ وَذَرُوا الَّذِينَ
يُلْحِدُونَ فِيٓ اَسْمَآئِهِۜ

---

**177) (سَآءَ مَثَلًا الْقَوْمُ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا) – o camaat ki bizim möcüzələrimizi və kitabımızı təkzib edib, onların məsəli nə pis məsəldir, köpək onlardan ötrü məsəl kimi qeyd olunur. İnsan yer üzündə ən şərəfli məxluqdur, heyvanatın ən dəyərsizi olan itə oxşadılır. (وَاَنْفُسَهُمْ كَانُوا يَظْلِمُونَ) – bizim ayələrimizi təkzib edənlər özlərinə zülm ediblər.**

**178) (مَنْ يَهْدِ اللّٰهُ فَهُوَ الْمُهْتَدِيۚ) – Allah-Təala kimə hidayət etsə, həqiqətən, hidayət tapan odur, (وَمَنْ يُضْلِلْ) – və Allah-Təala kimi öz əməli səbəbinə zəlalətə salsa, (فَاُولٰئِكَ هُمُ الْخَاسِرُونَ) – əlbəttə, ziyankar olub özlərinə zərər verənlər onlardır.**

**179) (وَلَقَدْ ذَرَأْنَا لِجَهَنَّمَ كَثِيرًا مِنَ الْجِنِّ وَالْاِنْسِۘ) – həqiqətən, cin və insandan çox şəxsləri tərk edib cəhənnəmdən ötrü yaratdıq. İman nuru onların qəlbinə daxil olmayıb, heç vaxt iman gətirməzlər. (لَهُمْ قُلُوبٌ لَا يَفْقَهُونَ بِهَاۘ) – onların qəlbləri vardır, amma o qəlblərlə haqdan bir şey anlamazlar, əsla qəlbləri yoxdur. (وَلَهُمْ اَعْيُنٌ لَا يُبْصِرُونَ بِهَاۘ) – onların gözləri vardır, amma haqdan heç bir şeyi görməzlər, sanki, anadangəlmə kordurlar, (وَلَهُمْ اٰذَانٌ لَا يَسْمَعُونَ بِهَا) – onların qulaqları vardır, amma heç bir şey eşitməzlər, (اُولٰٓئِكَ كَالْاَنْعَامِ) – onlar bu xüsusiyyətlərilə, sanki, dörd ayaqlı heyvan kimidirlər, necə ki heyvanın anlamaq, görmək və eşitmək imkanı yoxdur, haqdan kənar olan şəxslərin halı da belədir. (بَلْ هُمْ اَضَلُّ) – bəlkə, onlar heyvanatdan da artıq zəlalətdədirlər. Çünki heyvanat şüursuz yaradılıbdır. Amma insan mərifət və ağılla birlikdə yaradılıbdır, əlbəttə, ağıla tabe olmayan şəxslər heyvanatdan əskik olarlar. (اُولٰئِكَ هُمُ الْغَافِلُونَ) – tam qafil olub Allah-Təalanı inkar edənlər onlardır.**

**180) (وَلِلّٰهِ الْاَسْمَآءُ الْحُسْنٰى) – gözəl adlar Allah-Təalaya məxsusdur. (فَادْعُوهُ بِهَاۖ) – o adların hər biriylə Allah-Təalaya dua edin. (Müsəlmanlar Allah-Təalaya dua edib deyirlər: “Ey Allah, ey Rəhman, ey Rəhim. Müşriklər tənə vurub dedilər: “Müsəlmanlar deyirlər ki, biz bir Allah-Təalaya sitayiş edirik, bunlar gör neçə ad çəkirlər?” Onlar elə xəyal etdilər ki, bu adların hər biri bir məbudun adıdır. O vaxt da bu ayə nazil oldu). (وَذَرُوا الَّذِينَ يُلْحِدُونَ فِيٓ اَسْمَآئِهِ) – o şəxslər ki Allah-Təalanın adlarında haqdan uzaq-**

سَيُجْزَوْنَ مَا كَانُوا يَعْمَلُونَ ﴿١٨٠﴾ وَمِمَّنْ خَلَقْنَآ اُمَّةٌ يَهْدُونَ بِالْحَقِّ وَبِهِ يَعْدِلُونَ ﴿١٨١﴾ وَالَّذِينَ كَذَّبُوا
بِاٰيَاتِنَا سَنَسْتَدْرِجُهُمْ مِنْ حَيْثُ لَا يَعْلَمُونَ ﴿١٨٢﴾ وَاُمْلِي لَهُمْ اِنَّ كَيْدِي مَتِينٌ ﴿١٨٣﴾ اَوَلَمْ يَتَفَكَّرُوا
مَا بِصَاحِبِهِمْ مِنْ جِنَّةٍ اِنْ هُوَ اِلَّا نَذِيرٌ مُبِينٌ ﴿١٨٤﴾ اَوَلَمْ يَنْظُرُوا فِي مَلَكُوتِ السَّمٰوَاتِ وَالْاَرْضِ
وَمَا خَلَقَ اللّٰهُ مِنْ شَيْءٍ وَاَنْ عَسٰٓى اَنْ يَكُونَ قَدِ اقْتَرَبَ اَجَلُهُمْ فَبِاَيِّ حَدِيثٍ بَعْدَهُ يُؤْمِنُونَ ﴿١٨٥﴾

---

**laşıb, özlərindən Allah-Təalaya başqa mənasız adlar qoşur, onları tərk edin. (سَيُجْزَوْنَ مَا كَانُوا يَعْمَلُونَ) – əlbəttə, onlara öz əməllərinin cəzası verilər.**

**181) (وَمِمَّنْ خَلَقْنَآ اُمَّةٌ يَهْدُونَ بِالْحَقِّ)** – (ey Məhəmməd), **yaratdığımız insanlardan bir camaat vardır ki, özləri hidayətdə olmaqla birlikdə xalqı da haqq tərəfinə hidayət edərlər, (وَبِهِ يَعْدِلُونَ) – və haqqın tərəfinə yönələrlər.**

**182) (وَالَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَا) – o şəxslər ki bizim möcüzələrimizi təkzib edir, (سَنَسْتَدْرِجُهُمْ مِنْ حَيْثُ لَا يَعْلَمُونَ) – yavaş-yavaş onları bilmədikləri yöndən əzaba yaxınlaşdırarıq.** (Onlara bol nemət verərik, amma onlar bu nemətlərin müqabilində şükür etmək əvəzinə asi olub, itaətdən çıxdıqları üçün onları əzaba yaxınlaşdırarıq. Amma həmin nemətlərin onların əzabına səbəb olduğunu bilməzlər).

**183) (وَاُمْلِي لَهُمْ)** – (ey Məhəmməd), **kafir və müşriklərə möhlət verib, dünyada ömürlərini artırıb, ruzilərini bol edərəm. Amma bilməzlər ki, ömür və ruziləri onların əzabına səbəbdir. (اِنَّ كَيْدِي مَتِينٌ) – həqiqətən, mənim zahirdə onlara nemət verib, batində isə bu səbəbdən görəcəkləri əzab çox ağırdır. Əlbəttə, o nemətlər onlar üçün böyük əzaba bais olacaqdır. Çünki o nemətləri Allah-Təalanın istədiyi yerdə sərf etmirlər.**

**184) (اَوَلَمْ يَتَفَكَّرُوا مَا بِصَاحِبِهِمْ مِنْ جِنَّةٍ) – Hz. Məhəmmədə iman gətirməyənlər fikirləşmirlər ki, onda dəlilik yoxdur? Bəs niyə ona dəli deyirlər? (اِنْ هُوَ اِلَّا نَذِيرٌ مُبِينٌ) – bu Məhəmməd (ə.s) ancaq Allah-Təala tərəfindən açıq-aşkar qorxudandır.**

**185) (اَوَلَمْ يَنْظُرُوا فِي مَلَكُوتِ السَّمٰوَاتِ وَالْاَرْضِ) – bəs Allah-Təalanın səmalarda və yerdə olan böyük səltənətinə fikir verib baxmırlar? (وَمَا خَلَقَ اللّٰهُ مِنْ شَيْءٍ) – və Allah-Təalanın yaratdığı şeylərə baxmırlar** (ki, onlarda Allah-Təalanın hesaba gəlməyən nə qədər məxluqu var? Bəs bunlar Allah-Təalanın vəhdaniyyətinə işarə etməkdə kafi deyilmi? Ey Məhəmməd, bu zikr olunan şeylərə fikir verib, Qurani-Şərifə iman gətirmirlər? Halbuki Qurani-Şərif Allah-Təalanın vəhdaniyyətinə dəlildir). **(وَاَنْ عَسٰٓى اَنْ يَكُونَ قَدِ اقْتَرَبَ اَجَلُهُمْ) – bəs bunu fikirləşmirlər ki, həqiqətən, bəlkə, onların ölümü yaxın olub, küfr içində ölüb, dünyadan gedəcəklər? Təfəkkür edib baxmırlar ki, bu Quran haqdır, yoxsa yox? Nə qədər ki əcəlləri gəlməyib, Qurani-Şərifin haqq olduğunu dərk etsinlər. (فَبِاَيِّ حَدِيثٍ بَعْدَهُ يُؤْمِنُونَ) – Quranın sözünə iman**

مَنْ يُضْلِلِ اللّٰهُ فَلَا هَادِيَ لَهُ ۚ وَيَذَرُهُمْ فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ ﴿١٨٦﴾ يَسْـَٔلُونَكَ عَنِ السَّاعَةِ اَيَّانَ
مُرْسٰيهَاۜ قُلْ اِنَّمَا عِلْمُهَا عِنْدَ رَبّ۪يۚ لَا يُجَلّ۪يهَا لِوَقْتِهَٓا اِلَّا هُوَۚ ثَقُلَتْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِۜ لَا تَأْت۪يكُمْ
اِلَّا بَغْتَةًۜ يَسْـَٔلُونَكَ كَاَنَّكَ حَفِيٌّ عَنْهَاۜ قُلْ اِنَّمَا عِلْمُهَا عِنْدَ اللّٰهِ وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ ﴿١٨٧﴾
قُلْ لَٓا اَمْلِكُ لِنَفْس۪ي نَفْعًا وَلَا ضَرًّا اِلَّا مَا شَٓاءَ اللّٰهُۜ

---

**gətirməyəndən sonra hansı sözə iman gətirəcəklər? Quranın sözündən başqa hansı söz iman edilməyə layiqdir?** (Əlbəttə, Quranın məzmununa, fəsahət və bəlağətinə diqqət edib fikir verənlərdən ötrü Quranın insan kəlamı olmadığı zahir və aşkardır, çünki insan kəlamının oxşarı hökmən başqa bir insan tərəfindən də deyilə bilər. Amma Hz. Peyğəmbərdən bu zamanadək heç bir nəfər Qurani-Şərifin bənzərini ortaya qoya bilməyib. Halbuki ərəblərdən nə qədər fəsih xətiblər və şairlər inadkarlıqlarından Quranın haqq kəlam olduğunu inkar ediblər, əgər gücləri çatsaydı, əlbəttə, Quranın kiçik surələri kimi bir surə gətirib onu batil edərdilər. İnsaflı şəxs necə insafsızlıq edə bilər?)

**186) (مَنْ يُضْلِلِ اللّٰهُ فَلَا هَادِيَ لَهُ) – Allah-Təala kimi öz əməli səbəbi ilə zəlalətə salmış olsa, o şəxsə hidayət edən olmaz. (وَيَذَرُهُمْ فِي طُغْيَانِهِمْ يَعْمَهُونَ) – Allah-Təala onları öz zəlalətlərində qoyub, çaşqın və sərgərdan qalarlar.**

**187) (يَسْـَٔلُونَكَ عَنِ السَّاعَةِ اَيَّانَ مُرْسٰيهَا)** – (ey Məhəmməd), **səndən qiyamət gününü soruşurlar ki, nə vaxt qopacaq? (قُلْ اِنَّمَا عِلْمُهَا عِنْدَ رَبّ۪ي)** – (ey Məhəmməd), **de ki, qiyamətin nə vaxt qopacağının elmi mənim rəbbim Allah-Təalanın yanındadır, nə bir mələk, nə də bir peyğəmbər ona agah deyil, sadəcə Allah-Təala agahdır ki, o, nə vaxt vaqe olacaq, (لَا يُجَلّ۪يهَا لِوَقْتِهَٓا اِلَّا هُوَ) – qiyamət günü məxfi qalıb heç kim ondan agah olmayacaqdır. Qiyamət gününün vaxtını Allah-Təaladan başqası aşkar etməz, heç kim ondan vaxtından əvvəl agah olmaz. (ثَقُلَتْ فِي السَّمٰوَاتِ وَالْاَرْضِ) – qiyamət gününün gizlin qalması səma əhlinə və yer əhlinə çox ağırdır. Onun qopacağı vaxta agah olmağı hamı istəyər, amma Allah-Təala onu hikmət üzrə gizlin saxlayıbdır. (لَا تَأْت۪يكُمْ اِلَّا بَغْتَةً) – bütün insanlar öz əməllərilə, qazanc və sənətlərilə məşğul olduğu halda qiyamət günü sizə qəfil, xəbərsiz gələr, (يَسْـَٔلُونَكَ كَاَنَّكَ حَفِيٌّ عَنْهَا)** – (ey Məhəmməd), **sanki, sən onun vaxtına agahsanmış kimi səndən qiyamətin vaxtını soruşurlar ki, çox sual verməkləri səbəbi ilə onlardan ötrü onun vaxtını bəyan edəsən. (قُلْ اِنَّمَا عِلْمُهَا عِنْدَ اللّٰهِ) – daha əvvəl dediyin cavabı yenə onlara de: "Onun elmi Allah-Təalanın yanındadır. Çox israr etməyin, qiyamət gününün elmindən xəbərim yoxdur". (وَلٰكِنَّ اَكْثَرَ النَّاسِ لَا يَعْلَمُونَ) – lakin insanların əksəriyyəti agah deyil ki, qiyamət gününün elmi Allah-Təalaya məxsusdur. O səbəbdən səndən soruşurlar.**

**188) (قُلْ لَٓا اَمْلِكُ لِنَفْس۪ي نَفْعًا وَلَا ضَرًّا)** – (ey Məhəmməd), **de ki, mən özümdən ötrü nə bir xeyir, nə də bir zərərə malik deyiləm, (اِلَّا مَا شَٓاءَ اللّٰهُ) – ancaq**

وَلَوْ كُنْتُ اَعْلَمُ الْغَيْبَ لَاسْتَكْثَرْتُ مِنَ الْخَيْرِۚ وَمَا مَسَّنِيَ السُّوٓءُ اِنْ اَنَا اِلَّا نَذٖيرٌ وَبَشٖيرٌ لِقَوْمٍ يُؤْمِنُونَ ﴿١٨٨﴾ هُوَ الَّذٖي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ وَجَعَلَ مِنْهَا زَوْجَهَا لِيَسْكُنَ اِلَيْهَاۚ فَلَمَّا تَغَشّٰيهَا حَمَلَتْ حَمْلًا خَفٖيفًا فَمَرَّتْ بِهٖۚ فَلَمَّٓا اَثْقَلَتْ دَعَوَا اللّٰهَ رَبَّهُمَا

---

**Allah-Təalanın məndən ötrü istədiyi şey istisnadır. Allah-Təala məndən ötrü nə istəsə, o vaqe olar. (وَلَوْ كُنْتُ اَعْلَمُ الْغَيْبَ لَاسْتَكْثَرْتُ مِنَ الْخَيْرِ) – mənim haqqımda güman etməyin ki, mən hər bir şeyə agaham. Əgər mən qeybə agah olsaydım, (məsələn, sabah nə vaqe olacaq?) hər halda özümdən ötrü çox olan xeyir və mənfəətlər əldə edərdim. (وَمَا مَسَّنِيَ السُّوٓءُ) – əgər məndə qeyb elmi olsaydı, mənə heç bir zərər yetişməzdi** (və heç vaxt savaşlarda düşmən mənə qalib gələ bilməzdi. Çünki düşmənin fikrini bilib, onu dəf etməyə çarə tapardım. Məndə qeyb elmindən heç nə yoxdur). **(اِنْ اَنَا اِلَّا نَذٖيرٌ وَبَشٖيرٌ لِقَوْمٍ يُؤْمِنُونَ) – mən ancaq iman gətirənləri Allah-Təalanın əzabı ilə qorxudub, rəhmətilə müjdələyənəm.**

*(***Qeyd:** Müsəlmanlar bu ayəyə fikir versinlər ki, Allah-Təala Hz. Peyğəmbərin qeybi bilmədiyini necə bəyan edir. Ona əmr edir ki, insanlara belə de: "Məndə qeyb elmi yoxdur," ta ki onun barəsində mənasız sözlər danışmasınlar. Amma biz müsəlmanlar o qədər idraksız və cahil olmuşuq ki, Qurani-Şərifin sözlərini bir kənara qoyub, özümüzdən yalan və mənasız sözlər uydurub Qurani-Şərifdə Hz. Peyğəmbərin öz barəsində buyurduğu sözü inkar edib, nəinki ona, hətta imamlara, bəzi övliyalara, alimlərə və sufilərə də qeyb elmini isnad edirik. Adını kəramət qoyub deyirik ki, Allah-Təalanın bəndələrindən gərək kəramət meydana gəlsin. Halbuki müqəddəs İslam şəriətinin sahibi onların hamısını inkar edib. O həzrətin haqlılığına bir böyük dəlil də o əməlləri inkar etməsidir. O əməllərə iddia etmək kahinlərin, oyunbazların işidir, amma islam ümməti qəflətə düçar olub, bəsirətini itiribdir. Gül əvəzinə tikan, bülbül əvəzinə qarğa hakim olub. Özlərini alim kimi qələmə verənlər millətə rəhbər olub, öz oyunbaz əməllərini möcüzə hesab edib, bu kimi əməlləri şərəfli insanlara da isnad edib, islamın zəifləməsinə bais olurlar. İlahi, zəlalət səhrasında necə də çaşqın və sərgərdan qalmışıq).*

**189) (هُوَ الَّذٖي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ) – Allah-Təala siz insanları bir nəfərdən - Adəmdən yaratdı. (وَجَعَلَ مِنْهَا زَوْجَهَا) – Adəmin öz cinsindən ondan ötrü xanımını** (Həvvanı) **yaratdı. (İnsan Adəmlə Həvvanın ikisindən meydana gəlibdir. Amma soyda əsas ata sayıldığından təkcə Adəmə nisbət edildi). (لِيَسْكُنَ اِلَيْهَا) – Allah-Təala Adəmin öz cinsindən ona xanım yaratdı ki, ona meyil edib ondan qorxmasın. Çünki cins cinsə meyil edər. (فَلَمَّا تَغَشّٰيهَا) – Adəm Həvva ilə yaxınlıq edib onunla əlaqədə olduqda, (حَمَلَتْ حَمْلًا خَفٖيفًا ) –** (Həvva) **hamilə oldu, amma yüngül hamilə qalıb, heç bir əziyyət çəkmədi.** (Hamiləliyin ilk vaxtlarında hər bir qadının yükü yüngül olar). **(فَمَرَّتْ بِهٖ) – Həvva o yüklə bir müddət dolanıb, o zaman qədər ki, bətnindəki yükü yavaş-yavaş böyüdü. (فَلَمَّٓا اَثْقَلَتْ دَعَوَا اللّٰهَ رَبَّهُمَا) – yükü ağırlaşıb Həvvanın doğum**

لَئِنْ اٰتَيْتَنَا صَالِحًا لَنَكُونَنَّ مِنَ الشَّاكِرِينَ ﴿١٨٩﴾ فَلَمَّآ اٰتٰيهُمَا صَالِحًا جَعَلَا لَهُ شُرَكَآءَ فِيمَآ
اٰتٰيهُمَاۚ فَتَعَالَى اللّٰهُ عَمَّا يُشْرِكُونَ﴿١٩٠﴾ اَيُشْرِكُونَ مَا لَا يَخْلُقُ شَيْـًٔا وَهُمْ يُخْلَقُونَۘ ﴿١٩١﴾ وَلَا
يَسْتَطِيعُونَ لَهُمْ نَصْرًا وَلَآ اَنْفُسَهُمْ يَنْصُرُونَ﴿١٩٢﴾ وَاِنْ تَدْعُوهُمْ اِلَى الْهُدٰى لَا يَتَّبِعُوكُمْۜ سَوَآءٌ
عَلَيْكُمْ اَدَعَوْتُمُوهُمْ اَمْ اَنْتُمْ صَامِتُونَ﴿١٩٣﴾ اِنَّ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ عِبَادٌ اَمْثَالُكُمْ فَادْعُوهُمْ
فَلْيَسْتَجِيبُوا لَكُمْ اِنْ كُنْتُمْ صَادِقِينَ ﴿١٩٤﴾

---

**vaxtı yaxınlaşanda, Adəm və Həvva hər ikisi öz rəbləri Allah-Təalaya dua edib dedilər: (لَئِنْ اٰتَيْتَنَا صَالِحًا لَنَكُونَنَّ مِنَ الشَّاكِرِينَ) – "Ey bizim rəbbimiz, əgər bizə saleh övlad versən, hər halda, əlbəttə, sənə şükür edənlərdən olarıq".**

**190) (فَلَمَّآ اٰتٰيهُمَا صَالِحًا) – Allah-Təala onlara saleh övlad verdikdə isə, (جَعَلَا لَهُ شُرَكَآءَ فِيمَآ اٰتٰيهُمَاۚ) – onlara verdiyi bu övlad haqqında Allah-Təalaya şəriklər qoşdular,** (övladın dünyaya gəlməsini özlərindən gələn spermaya və Həvvanın rəhminə isnad etdilər, şirkdən məqsəd budur, nəinki ibadətdə Allah-Təalanı şərik qoşmaqdır. Adəm və Həvva ibadətdə Allah-Təalaya şərik qoşmaqdan pak və müqəddəsdirlər. Ayənin özü bu mətləbə açıq-aşkar işarədir. Çünki buyurur ki, onlara verdiyi övlad haqqında Allah-Təalaya şərik qoşdular. Amma Allah-Təala bu şərikə razı olmayıb, özünü şirkdən pak və müqəddəs sayıb buyurur:) **(فَتَعَالَى اللّٰهُ عَمَّا يُشْرِكُونَ) – Allah-Təala insanların ona ortaq qoşduğu şəriklərdən ucadır.**

**191) (اَيُشْرِكُونَ مَا لَا يَخْلُقُ شَيْـًٔا) – insanlar Allah-Təalaya o şeyləri şərik qoşurlar ki, onlar heç bir şeyi yaratmağa qadir deyillər. (وَهُمْ يُخْلَقُونَ) – halbuki onların özlərini də Allah-Təala yaradıbdır.**

**192) (وَلَا يَسْتَطِيعُونَ لَهُمْ نَصْرًا) – o şəriklərin onlara ibadət edənlərə kömək etməyə qüdrətləri yoxdur. (وَلَآ اَنْفُسَهُمْ يَنْصُرُونَ) – özlərinə də kömək edib, bəla və müsibəti özlərindən dəf etməyə qadir deyildirlər, belə şeyləri Allah-Təalaya şərik qoşmaq olarmı?**

**193) (وَاِنْ تَدْعُوهُمْ اِلَى الْهُدٰى لَا يَتَّبِعُوكُمْ) – əgər o şərikləri sizi xeyir və mənfəət tərəfinə hidayət etsinlər deyə çağırsanız da, sizin istədiyinizə cavab verməzlər.** (Necə ki Allah-Təala cavab verir). **(سَوَآءٌ عَلَيْكُمْ اَدَعَوْتُمُوهُمْ اَمْ اَنْتُمْ صَامِتُونَ) – indi ki belədir, o şərikləri çağırsanız da, çağırmasanız da, hər ikisi sizdən ötrü eynidir. Çünki onlardan sizə bir fayda olmaz.**

**194) (اِنَّ الَّذِينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ عِبَادٌ اَمْثَالُكُمْ) – həqiqətən, o şeyləri ki, çağırıb, Allah-Təaladan başqa onlara ibadət edirsiniz, heç olmazsa, sizin kimi ağıllı və şüurlu bəndələr olsaydılar?** (Halbuki belə deyil. Belə cansız və şüursuz şeyləri Allah-Təalaya şərik qoşursunuz). **(فَادْعُوهُمْ فَلْيَسْتَجِيبُوا لَكُمْ اِنْ كُنْتُمْ صَادِقِينَ) –**

اَلَهُمْ اَرْجُلٌ يَمْشُونَ بِهَاۤ اَمْ لَهُمْ اَيْدٍ يَبْطِشُونَ بِهَاۤ اَمْ لَهُمْ اَعْيُنٌ يُبْصِرُونَ بِهَاۤ اَمْ لَهُمْ اٰذَانٌ يَسْمَعُونَ بِهَاۜ
قُلِ ادْعُوا شُرَكَآءَكُمْ ثُمَّ كِيدُونِ فَلَا تُنْظِرُونِ ﴿١٩٥﴾ اِنَّ وَلِيِّيَ اللّٰهُ الَّذِي نَزَّلَ الْكِتَابَۘ وَهُوَ يَتَوَلَّى
الصَّالِحِينَ﴿١٩٦﴾ وَالَّذِينَ تَدْعُونَ مِنْ دُونِهِ لَا يَسْتَطِيعُونَ نَصْرَكُمْ وَلَٓا اَنْفُسَهُمْ يَنْصُرُونَ﴿١٩٧﴾
وَاِنْ تَدْعُوهُمْ اِلَى الْهُدٰى لَا يَسْمَعُواۜ وَتَرٰيهُمْ يَنْظُرُونَ اِلَيْكَ وَهُمْ لَا يُبْصِرُونَ﴿١٩٨﴾ خُذِ الْعَفْوَ
وَاْمُرْ بِالْعُرْفِ وَاَعْرِضْ عَنِ الْجَاهِلِينَ ﴿١٩٩﴾

---

**əgər bunlar Allah-Təalaya şərikdirlər sözünü doğru deyirsinizsə, onları çağırın ki, sizin dualarınızı qəbul edib ehtiyaclarınızı həll etsinlər.**

**195) (اَلَهُمْ اَرْجُلٌ يَمْشُونَ بِهَاۤ) – bəs o bütlərin ayaqları var ki, onunla yol getsinlər? (اَمْ لَهُمْ اَيْدٍ يَبْطِشُونَ بِهَاۤ) – ya da əlləri vardır ki, bəlanı və düşməni özlərindən dəf etsinlər? (اَمْ لَهُمْ اَعْيُنٌ يُبْصِرُونَ بِهَاۤ) – yoxsa gözləri vardır ki, onunla görsünlər? (اَمْ لَهُمْ اٰذَانٌ يَسْمَعُونَ بِهَا) – və ya qulaqları vardır ki, onunla eşitsinlər? (قُلِ ادْعُوا شُرَكَآءَكُمْ)** – (ey Məhəmməd), **müşriklərə de ki, Allah-Təalaya şərik qoşduqlarınızı çağırın, (ثُمَّ كِيدُونِ فَلَا تُنْظِرُونِ) – ondan sonra özünüzün və şəriklərinizin hər nə məkr və hiyləsi varsa, mənim haqqımda edib mənə möhlət verməyin, mənim sizdən heç bir qorxum yoxdur.**

**196) (اِنَّ وَلِيِّيَ اللّٰهُ الَّذِي نَزَّلَ الْكِتَابَ) – həqiqətən, mənimköməkçim o Allah-Təaladır ki, mənə kitab göndəribdir. (وَهُوَ يَتَوَلَّى الصَّالِحِينَ) – saleh şəxslərə kömək edib onların işinə yardımçı olan Allah-Təalanın özüdür.**

**197) (وَالَّذِينَ تَدْعُونَ مِنْ دُونِهِ) – o bütlər ki, Allah-Təaladan başqa çağırıb ibadət edirsiniz, (لَا يَسْتَطِيعُونَ نَصْرَكُمْ) – onların sizə kömək etməyə qüdrətləri yoxdur, (وَلَٓا اَنْفُسَهُمْ يَنْصُرُونَ) – nə də özlərinə kömək edib, varid olan bəlaları özlərindən dəf etməyə qadir deyillər, belə şeylərə sitayiş etmək olmaz.**

**198) (وَاِنْ تَدْعُوهُمْ اِلَى الْهُدٰى لَا يَسْمَعُواۜ) – əgər o bütləri sizi xeyir əməl tərəfinə hidayət etməyə çağırsanız, sizin çağırmağınızı eşitməzlər, (وَتَرٰيهُمْ يَنْظُرُونَ اِلَيْكَ)** – (ey Məhəmməd), **o bütlərin, sanki, sənə baxdığını görürsən,** (bütləri insan və ya mələk şəklində düzəldirdilər), **(وَهُمْ لَا يُبْصِرُونَ) – amma o bütlər heç bir şeyi görüb dərk edən deyillər. Bu ayələri təkrar verməkdə məqsəd bütpərəstlərin qəbahətini açıq-aşkar göstərməkdir.**

**199) (خُذِ الْعَفْوَ وَاْمُرْ بِالْعُرْفِ)** – (ey Məhəmməd), **bu müşriklər sənə əziyyət edirlər, onların əziyyətinə səbir et, onları əfv edib bağışlamağı özünə şüar et. Yaxşı və gözəl olan əməlləri xalqa əmr et. (وَاَعْرِضْ عَنِ الْجَاهِلِينَ) – cahil şəxslərdən üz döndər. Onların pisliyinin əvəzində sən pislik etmə, onlar pislik etsələr, sən onlara güzəşt et.***

*(***Qeyd:** *Bu ayədə Allah-Təala öz peyğəmbərinə gözəl əxlaqı əmr edir. İslam ümməti də gərək, öz peyğəmbərinə tabe olub, Qurani-Şərifə itaət etsin. Nəinki ayəni*

وَامَّا يَنْزَغَنَّكَ مِنَ الشَّيْطَانِ نَزْغٌ فَاسْتَعِذْ بِاللّٰهِ اِنَّهُ سَمِيعٌ عَلِيمٌ ﴿٢٠٠﴾ اِنَّ الَّذِينَ اتَّقَوْا اِذَا مَسَّهُمْ
طَائِفٌ مِنَ الشَّيْطَانِ تَذَكَّرُوا فَاِذَا هُمْ مُبْصِرُونَ ﴿٢٠١﴾ وَاِخْوَانُهُمْ يَمُدُّونَهُمْ فِي الْغَيِّ ثُمَّ لَا يُقْصِرُونَ
﴿٢٠٢﴾ وَاِذَا لَمْ تَأْتِهِمْ بِاٰيَةٍ قَالُوا لَوْلَا اجْتَبَيْتَهَا قُلْ اِنَّمَٓا اَتَّبِعُ مَا يُوحٰىٓ اِلَيَّ مِنْ رَبِّيۚ هٰذَا بَصَٓائِرُ مِنْ
رَبِّكُمْ وَهُدًى وَرَحْمَةٌ لِقَوْمٍ يُؤْمِنُونَ ﴿٢٠٣﴾

---

*tərk edib, zülmü özlərinə şüar etsinlər. Necə ki bizim bu dövrdə yaxşı əməl sahibləri xalqın içində zəlil olub, amma fasiq və günahkarlar, qatillər şərəfli və möhtərəm sayılırlar. Bu ayənin mənası haqda uca peyğəmbərimiz buyurubdur: “Kim ki qohum-əqrəbasına yaxşılıq etmir, sən onun əvəzinə ona yaxşılıq et. Kim ki sənin ehtiyacını həll etməyib, səni məhrum etsə, sən onu məhrum etməyib, ehtiyacını həll et. Kim sənə zülm etsə, sən onu bağışlayıb onun zülmünü əfv et).*

**200) (وَامَّا يَنْزَغَنَّكَ مِنَ الشَّيْطَانِ نَزْغٌ)** – (ey Məhəmməd)**, əgər sənə şeytandan bir vəsvəsə gəlsə, (فَاسْتَعِذْ بِاللّٰهِ) – o vaxt şeytanın vəsvəsəsindən Allah-Təalaya pənah aparıb belə de:** (əuzü billahi minəş-şeytanir-rəcim)**, (اِنَّهُ سَمِيعٌ عَلِيمٌ) – həqiqətən, Allah-Təala sənin dua edib Allah-Təalaya pənah aparmanı eşidib əhvalından agahdır.**

**201) (اِنَّ الَّذِينَ اتَّقَوْا) – həqiqətən, o şəxslər ki qorxub, Allah-Təalaya itaət edir, (اِذَا مَسَّهُمْ طَائِفٌ مِنَ الشَّيْطَانِ تَذَكَّرُوا) – onlara xəyalına nə zaman şeytandan bir vəsvəsə gəlsə, dərhal bilərlər ki, bu şeytan vəsvəsəsidir. (فَاِذَا هُمْ مُبْصِرُونَ) – qəfildən bəsirətləri açılıb, haqqı görüb şeytanın vəsvəsəsini özlərindən dəf edərlər.**

**202) (وَاِخْوَانُهُمْ يَمُدُّونَهُمْ فِي الْغَيِّ) – amma şeytanların qardaşlarına və onlara itaət edənlərə şeytanlar öz zəlalətlərində kömək edib, zəlalətdən heç vaxt xilas olmazlar. (ثُمَّ لَا يُقْصِرُونَ) – elə ki onlar zəlalətdə qaldılar, şeytanlar onları zəlalətdə möhkəm etmək üçün onlardan əl çəkməzlər ki, onları tam zəlalətə salıb, heç vaxt oradan çıxa bilməsinlər.**

**203) (وَاِذَا لَمْ تَأْتِهِمْ بِاٰيَةٍ)** – (ey Məhəmməd)**, müşriklər səndən bir möcüzə istəyib, o möcüzəni sən gətirmədikdə, (قَالُوا لَوْلَا اجْتَبَيْتَهَا)** – (müşriklər) **dedilər: sən niyə bizdən ötrü bir möcüzə düzəldib gətirmirsən?** (Sən ki hər bir şeyi öz yanından gətirirsən, möcüzə də gətir). **(قُلْ اِنَّمَٓا اَتَّبِعُ مَا يُوحٰىٓ اِلَيَّ مِنْ رَبِّي)** – (ey Məhəmməd)**, de ki, həqiqətən, mən ancaq rəbbim Allah-Təaladan mənə vəhy olunan hökmə tabeyəm.** (Öz yanımdan heç bir şey gətirməyə qadir deyiləm)**. (هٰذَا بَصَٓائِرُ مِنْ رَبِّكُمْ) – bu Quran rəbbinizdən** (gələn) **açıq-aşkar bir dəlildir, (وَهُدًى وَرَحْمَةٌ لِقَوْمٍ يُؤْمِنُونَ) – bu Quran Allah-Təalaya iman gətirən bir camaat üçün hidayət və rəhmətdir, məndən bu Qurandan başqa bir möcüzə görə bilməzsiniz.**

وَاذَا قُرِئَ الْقُرْاٰنُ فَاسْتَمِعُوا لَهُ وَاَنْصِتُوا لَعَلَّكُمْ تُرْحَمُونَ ﴿٢٠٤﴾ وَاذْكُرْ رَبَّكَ فِي نَفْسِكَ تَضَرُّعًا
وَخِيفَةً وَدُونَ الْجَهْرِ مِنَ الْقَوْلِ بِالْغُدُوِّ وَالْاٰصَالِ وَلَا تَكُنْ مِنَ الْغَافِلِينَ ﴿٢٠٥﴾ اِنَّ الَّذِينَ عِنْدَ رَبِّكَ
لَا يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتِهٖ وَيُسَبِّحُونَهُ وَلَهُ يَسْجُدُونَ﴿٢٠٦﴾

---

**204) (وَاذَا قُرِئَ الْقُرْاٰنُ فَاسْتَمِعُوا لَهُ وَاَنْصِتُوا) – ey möminlər, Quran oxunduğu zaman, Qurana qulaq asıb sakit olun. Ədəbə riayət edib, söhbət etməyin. (لَعَلَّكُمْ تُرْحَمُونَ) – Qurana hörmət etdiyiniz üçün Allah-Təala da sizə rəhm edib günahlarınızı bağışlayar. ***

*(****Qeyd:*** İlahi, bu Quranı özümüzdən ötrü dünya mənfəəti üçün bir vasitə etmişik. Bizdə nə gəzir o ədəb və ehtiram ki, Qurani-Şəriflə düzgün rəftar edək? Qurani-Şərif oxunanda ancaq onun uca məzmununa əməl edən şəxs sakit olub qulaq asar. Alimlərdə bu ədəb olmayanda, avam xalqda hardan olsun? Qurani-Şərif bu dövrdə ancaq ölülərin üstündə oxunub, pul qazanmaqdan başqa bir şeyə lazım deyil. İlahi, sən özün agahsan ki, mən həqir bu sözləri pis niyyətlə və iftira etmək üçün demirəm. Əksinə, həqiqəti ifadə edirəm).*

**205) (وَاذْكُرْ رَبَّكَ فِي نَفْسِكَ تَضَرُّعًا وَخِيفَةً وَدُونَ الْجَهْرِ مِنَ الْقَوْلِ)** – (ey Məhəmməd), **rəbbin Allah-Təalanı gizlində, qorxu içində yalvararaq, çığırıb bağırmadan, gizli kəlamlarla zikr edib həmd-səna et. (بِالْغُدُوِّ وَالْاٰصَالِ) – Allah-Təalanı səhər-axşam belə zikr et. (وَلَا تَكُنْ مِنَ الْغَافِلِينَ) – Allah-Təaladan qafil olan şəxslərdən olma.**

**206) (اِنَّ الَّذِينَ عِنْدَ رَبِّكَ)** – (ey Məhəmməd)**, həqiqətən, o şəxslər** (peyğəmbərlər, övliyalar) **ki, sənin rəbbin Allah-Təalanın yanında böyük dərəcə sahibidirlər, (لَا يَسْتَكْبِرُونَ عَنْ عِبَادَتِهٖ) – onlar Allah-Təalaya ibadət etməkdə təkəbbür etməzlər.** (Bəs başqaları niyə təkəbbürlənib, cansız şeyləri Allah-Təalaya şərik qoşurlar?) **(وَيُسَبِّحُونَهُ وَلَهُ يَسْجُدُونَ) – Allah-Təalaya ibadətdə təkəbbürlənməyənlər həmişə Allah-Təalanı zikr edib ona ibadət edib, səcdə edərlər,** (ondan başqasına ibadət etməzlər. Siz də onlara tabe olub Allah-Təaladan başqasına ibadət etməyin).

Allaha həmd olsun, Əraf surəsinin təfsiri tamamlandı. Hz. Peyğəmbər buyurubdur: "Kim Əraf surəsini oxusa, Allah-Təala onunla şeytan arasında bir pərdə qoyar, Hz. Adəm də qiyamət günündə o şəxsdən ötrü şəfaət istəyər".

## əl-ƏNFAL SURƏSİ

8-ci surədir. Məkkədə nazil olub, 75 ayə, 1075 kəlmə və 5080 hərfdir.

بِسْمِ اللهِ الرَّحْمٰنِ الرَّحِيمِ. يَسْأَلُونَكَ عَنِ الْأَنْفَالِ قُلِ الْأَنْفَالُ لِلَّهِ وَالرَّسُولِ فَاتَّقُوا اللَّهَ وَأَصْلِحُوا
ذَاتَ بَيْنِكُمْ وَأَطِيعُوا اللَّهَ وَرَسُولَهُ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿١﴾ إِنَّمَا الْمُؤْمِنُونَ الَّذِينَ إِذَا ذُكِرَ اللَّهُ
وَجِلَتْ قُلُوبُهُمْ وَإِذَا تُلِيَتْ عَلَيْهِمْ آيَاتُهُ زَادَتْهُمْ إِيمَانًا وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ ﴿٢﴾ الَّذِينَ يُقِيمُونَ
الصَّلَاةَ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ ﴿٣﴾ أُولَئِكَ هُمُ الْمُؤْمِنُونَ حَقًّا لَهُمْ دَرَجَاتٌ عِنْدَ رَبِّهِمْ وَمَغْفِرَةٌ
وَرِزْقٌ كَرِيمٌ ﴿٤﴾

---

### Bismillahir-Rəhmanir-Rəhim

**1)** (يَسْأَلُونَكَ عَنِ الْأَنْفَالِ) – (ey Məhəmməd)**, səndən cihadda olan qənimətlər haqqında soruşurlar ki, o qənimət kimin ixtiyarındadır və onu kim bölüşdürəcək?** (قُلِ الْأَنْفَالُ لِلَّهِ وَالرَّسُولِ) – (ey Məhəmməd)**, de ki, qənimət Allah-Təalanın və peyğəmbərindir, onun ixtiyarı peyğəmbərdədir. Necə istəsə, elə də bölüşdürər.** (فَاتَّقُوا اللَّهَ وَأَصْلِحُوا ذَاتَ بَيْنِكُمْ) – **Allah-Təaladan qorxub, qənimətə görə, bir-birinizlə düşmənçilik etməyin. Bir-birinizin arasını islah edin. Bir-birinizə kömək edin.** (وَأَطِيعُوا اللَّهَ وَرَسُولَهُ إِنْ كُنْتُمْ مُؤْمِنِينَ) – **əgər Qurana iman gətiribsinizsə, Allah-Təalaya və onun peyğəmbərinə** (Hz. Məhəmmədə) **itaət edib, qənimət barəsində ixtilaf etməyin.**

**2)** (إِنَّمَا الْمُؤْمِنُونَ الَّذِينَ إِذَا ذُكِرَ اللَّهُ وَجِلَتْ قُلُوبُهُمْ) – **həqiqətən, möminlər o şəxslərdir ki, onların yanında Allah-Təala zikr olunduğu zaman qəlblərini Allah-Təala qorxusu bürüyər.** (وَإِذَا تُلِيَتْ عَلَيْهِمْ آيَاتُهُ زَادَتْهُمْ إِيمَانًا) – **Allah-Təalanın hökmləri onlara oxunduğu zaman, imanları da artar.** (وَعَلَى رَبِّهِمْ يَتَوَكَّلُونَ) – **möminlərin xüsusiyyətlərindən biri də budur ki, bütün işlərində rəbləri Allah-Təalaya təvəkkül edərlər.**

**3)** (الَّذِينَ يُقِيمُونَ الصَّلَاةَ) – **möminlərin xüsusiyyətlərindən biri də odur ki, namaz qılıb, heç vaxt onu tərk etməzlər.** (وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ) – **onlara verdiyimiz ruzidən Allah-Təala yolunda ehsan edərlər.**

**4)** (أُولَئِكَ هُمُ الْمُؤْمِنُونَ حَقًّا) – **bu qeyd olunanlar həqiqi möminlərdir.** (لَهُمْ دَرَجَاتٌ عِنْدَ رَبِّهِمْ وَمَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ) – **o möminlərdən ötrü öz rəbləri Allah-Təala yanında necə dərəcələr** (məqamlar)**, bağışlanmaq və gözəl olan ruzi vardır.**

كَمَا أَخْرَجَكَ رَبُّكَ مِنْ بَيْتِكَ بِالْحَقِّ وَإِنَّ فَرِيقًا مِنَ الْمُؤْمِنِينَ لَكَارِهُونَ ﴿٥﴾

---

**5) (كَمَا أَخْرَجَكَ رَبُّكَ مِنْ بَيْتِكَ بِالْحَقِّ)** – (Ənfal surəsi Bədir savaşını bəyan etmək üçün nazil olubdur. Bu ayədən sonra savaş əhvalatı bir-bir bəyan edilir. Ayənin mənası belədir, buyurur: "Ey Məhəmməd, Bədir savaşında qəniməti bölüşdürməni xoşlamadıqları kimi), **Allah-Təalanın səni Mədinədən, öz evindən çıxardıb, haqq üçün Bədir savaşına götürməni də xoşlamadılar. Əlbəttə, imanlarında möhkəm olan şəxslərdən başqası savaşa getməyi xoşlamaz,** (Bədir savaşı islamın ilk dövrlərində olduğundan möminlərdən bir qrup savaşa getmək istəmədi. Amma savaşa hazırlaşandan sonra inanclarında möhkəm olub müşriklərin sayca özlərindən çox olan ordusunu dağıtdılar). **(وَإِنَّ فَرِيقًا مِنَ الْمُؤْمِنِينَ لَكَارِهُونَ)** – **həqiqətən, hamısı deyil, ancaq möminlərdən bir dəstə Bədir* savaşından ötrü Mədinədən çıxmağı xoşlamadı.**

*(*__Qeyd:__ Bədir Məkkə ilə Mədinə arasında bir yerin adıdır. Ərəblər ildə bir dəfə oraya toplanıb, alış-veriş və ticarət edərdilər. Məkkə əhli ildə bir dəfə Şama ticarətə gedərdi. Bir dəfə də Məkkə əhli 40 dəvə yükü malla Şamdan qayıdıb Mədinənin ətrafından keçəndə Məkkəyə xəbər gəldi ki, Hz. Məhəmmədin Mədinədəki tərəfdarları bu karvanı qarət etmək üçün Mədinədən çıxıblar. Əbu Cəhl Kəbənin damına çıxıb car çəkdi. Məkkə əhli oraya toplandı. Dedi: "Ey Məkkə əhli, gərək toplanıb, karvana kömək etmək üçün Bədirə gedəsiniz". 950 nəfər toplanıb, Məkkədən Bədirə yola düşdü. Məkkədən çıxandan sonra xəbər gəldi ki, karvan dəniz sahili yolu ilə sağ-salamat Məkkəyə gəlib çatıb. Karvanın rəisi Əbu Süfyan xəbər göndərib ki, savaşmaq lazım deyil, qayıdıb Məkkəyə gəlin və ticarətlə məşğul olun. Əbu Cəhl dedi: "Bu, əsla mümkün deyil, gərək, biz gedib Bədir quyularına çataq, orada şərab içib, kabab yeyək, qadın müğənnilər də bizdən ötrü mahnı oxusunlar. Ondan sonra qayıdaq Kəbəyə, ərəblər də görsün ki, biz heç kimdən qorxmuruq. Məhəmməd və onun yoldaşları bizə heç bir zərər verə bilməzlər. Əbu Cəhl və Məkkə ordusu gəlib Bədir quyularına çatdılar. O biri tərəfdən də karvan sağ-salamat Məkkəyə gəlib çatdı. Karvanın rəisi Əbu Süfyan idi. Əmr ibn As və Əmr ibn Hişam da onunla birlikdə idilər. Bu biri tərəfdən də Hz. Peyğəmbər Mədinə əhlini düşmənlə savaşmağa təşviq etdi. Möminlərin bəzisi bunu istəmədi. Hz. Peyğəmbər istədi ki, onları qənimətlə savaşa həvəsləndirsin. Onlara belə dedi: "Ümid var ki, karvanı ələ keçirib, qənimət alasınız, savaşa da ehtiyac olmasın". Bu həvəslə Mədinə əhlindən 313 nəfər çıxıb Bədirə yönəldilər, o biri tərəfdən də karvan sağ-salamat Məkkəyə gedib çatdı. Karvanın Məkkəyə çatması və Məkkə əhlinin Bədir quyularına yaxınlaşması Hz. Peyğəmbərin səhabələrinə məlum oldu. Hz. Peyğəmbər səhabələrini toplayıb, onlarla məsləhətləşdi. Buyurdu: "Bu barədə nə deyirsiniz, Mədinəyə qayıdaq, yoxsa savaşa hazırlaşaq?" Əbu Bəkir və Ömər savaşın lehinə səs verdilər. Ondan sonra Miqdad ibn Əmr ayağa durub dedi: "Ey Peyğəmbər, Allah-Təala sənə nə əmr edibsə, onu da et". Hz. Peyğəmbər buyurdu: "Ey insanlar, fikrinizi bildirin". Hz. Peyğəmbər ənsarın fikrini bilmək istəyirdi. Ənsardan Sə`d ibn Übadə ayağa durub dedi: "Ey Peyğəmbər, sən Allahın əmrinə bax. Əgər Ədn məmləkətinə də getsən, biz sənə itaət edərik. Ənsardan heç kim səni*

يُجَادِلُونَكَ فِي الْحَقِّ بَعْدَمَا تَبَيَّنَ كَأَنَّمَا يُسَاقُونَ إِلَى الْمَوْتِ وَهُمْ يَنْظُرُونَ ﴿٦﴾ وَإِذْ يَعِدُكُمُ اللَّهُ إِحْدَى الطَّائِفَتَيْنِ أَنَّهَا لَكُمْ وَتَوَدُّونَ أَنَّ غَيْرَ ذَاتِ الشَّوْكَةِ تَكُونُ لَكُمْ وَيُرِيدُ اللَّهُ أَنْ يُحِقَّ الْحَقَّ بِكَلِمَاتِهِ وَيَقْطَعَ دَابِرَ الْكَافِرِينَ ﴿٧﴾ لِيُحِقَّ الْحَقَّ وَيُبْطِلَ الْبَاطِلَ وَلَوْ كَرِهَ الْمُجْرِمُونَ ﴿٨﴾ إِذْ تَسْتَغِيثُونَ رَبَّكُمْ

---

*tərk etməz". Ondan sonra Sə`d ibn Muaz ayağa durub dedi: "Ey Peyğəmbər, deyəsən, sənin məqsədin biz ənsardır". Buyurdu: "Belədir, ya Sə`d". Dedi: "Ey Peyğəmbər, biz sənə iman gətirib səni təsdiq eləmişik və şəhadət edirik ki, dediyin hər şey Allah-Təala tərəfindən olub haqdır. Ya peyğəmbər, əgər bizim üzümüzü bu dənizə döndərib dənizə daxil olsan, biz ənsar yenə səninlə birlikdə dənizə daxil olacağıq. Biz savaşda səbirli və möhkəmik. Allah-Təalanın köməyi ilə düşmənə yönəlib, savaşa hazırlaş". Bu sözlərdən Hz. Peyğəmbər şad olub buyurdu: "Düşmən tərəfinə yola düşək. Allah-Təala mənə düşmənə qalib olmağı vəd edibdir. Sanki, müşriklərin öldürüldüyü yerləri görürəm". Ondan sonra gəlib Bədirdə hər iki dəstə bir-biri ilə qarşılaşdı. Savaş başladı, 313 nəfərlik müsəlman ordusu 950 nəfərlik Məkkə ordusuna qalib gəldi. Onların böyüklərini - Utbə və Şeybə, Vəlid, Əbu Cəhl kimi şəxsləri qətlə yetirdilər. Onlardan 70 nəfəri qətlə yetirib, 70 nəfəri də əsir etdilər. Digər məkkəlilər qaçıb dağıldılar. Hz. Peyğəmbərin əmisi Abbas, Hz. Əlinin qardaşı Aqil əsir oldular. Ondan sonra müsəlman oldular, Hz. Peyğəmbər də onlara icazə verdi ki, kim istəyirsə, bir şeylər verib özünü azad edə bilər. Heç kimi də islama daxil olmağa məcbur etmədi. Bu əhvalat həmin surədə zikr olunan ayələrdə xəbər verilir).*

**6)** (يُجَادِلُونَكَ فِي الْحَقِّ بَعْدَمَا تَبَيَّنَ) – (ey Məhəmməd)**, sən onlara düşmənə qalib gəlməyi vəd edəndən sonra da möminlər səninlə münaqişə edirdilər,** (كَأَنَّمَا يُسَاقُونَ إِلَى الْمَوْتِ وَهُمْ يَنْظُرُونَ) **– sanki, onları göz görə-görə ölümə aparırlarmış kimi** (davranırdılar)**.**

**7)** (وَإِذْ يَعِدُكُمُ اللَّهُ إِحْدَى الطَّائِفَتَيْنِ أَنَّهَا لَكُمْ) **– o zaman Allah-Təala sizə iki dəstədən birini (ya karvan, ya da Məkkə ordusunu) vəd etdi, o iki dəstədən biri əlbəttə, sizin olacaqdır.** (وَتَوَدُّونَ أَنَّ غَيْرَ ذَاتِ الشَّوْكَةِ تَكُونُ لَكُمْ) **– amma siz o iki dəstədən qüvvətli olmayanla qarşılaşıb ələ keçirmək istəyirdiniz. (Yəni siz istəyirsiniz ki, karvanla qarşılaşıb, onu qarət edəsiniz).** (وَيُرِيدُ اللَّهُ أَنْ يُحِقَّ الْحَقَّ بِكَلِمَاتِهِ وَيَقْطَعَ دَابِرَ الْكَافِرِينَ) **– amma Allah-Təalanın istəyi odur ki, savaş olsun, savaş haqqında ayələr nazil edib, islam dinini ucaldıb möhkəmləndirsin.**

**8)** (لِيُحِقَّ الْحَقَّ وَيُبْطِلَ الْبَاطِلَ) **– yenə Allah-Təalanın istəyi odur ki, savaş səbəbi ilə islam dinini möhkəmlədib, küfr və şirki batil etsin,** (وَلَوْ كَرِهَ الْمُجْرِمُونَ) **– hərçənd müşriklər islamın möhkəmlənməsini istəmirlər, lakin Allah-Təala islam dinini yayacaqdır.**

**9)** (إِذْ تَسْتَغِيثُونَ رَبَّكُمْ) – (elə ki müsəlmanlar müşriklərlə qarşılaşıb, onların min nəfərə yaxın, özlərinin isə 313 nəfər olduğunu gördülər, qorxu onları bürüyüb, başladılar dua etməyə, necə ki buyurur:) **o zaman ki siz möminlər ahnalə edib rəbbiniz Allah-Təalaya dua edib dediniz: "İlahi, sən bizə kömək**

فَاسْتَجَابَ لَكُمْ أَنِّي مُمِدُّكُمْ بِأَلْفٍ مِنَ الْمَلَائِكَةِ مُرْدِفِينَ ﴿٩﴾ وَمَا جَعَلَهُ اللهُ إِلَّا بُشْرَى وَلِتَطْمَئِنَّ بِهِ قُلُوبُكُمْ وَمَا النَّصْرُ إِلَّا مِنْ عِنْدِ اللهِ إِنَّ اللهَ عَزِيزٌ حَكِيمٌ ﴿١٠﴾ إِذْ يُغَشِّيكُمُ النُّعَاسَ أَمَنَةً مِنْهُ وَيُنَزِّلُ عَلَيْكُمْ مِنَ السَّمَاءِ مَاءً لِيُطَهِّرَكُمْ بِهِ وَيُذْهِبَ عَنْكُمْ رِجْزَ الشَّيْطَانِ وَلِيَرْبِطَ عَلَى قُلُوبِكُمْ وَيُثَبِّتَ بِهِ الْأَقْدَامَ ﴿١١﴾ إِذْ يُوحِي رَبُّكَ إِلَى الْمَلَائِكَةِ أَنِّي مَعَكُمْ فَثَبِّتُوا الَّذِينَ آمَنُوا سَأُلْقِي فِي قُلُوبِ الَّذِينَ كَفَرُوا الرُّعْبَ

---

**ol”. (فَاسْتَجَابَ لَكُمْ أَنِّي مُمِدُّكُمْ بِأَلْفٍ مِنَ الْمَلَائِكَةِ مُرْدِفِينَ) – Allah-Təala duanızı qəbul edib sizə belə dedi: “Həqiqətən, sizin dalınızca gəlib, Bədirdə hazır olan, min nəfər mələklə sizə kömək edəcəyəm”.**

**10) (وَمَا جَعَلَهُ اللهُ إِلَّا بُشْرَى) – Allah-Təala ancaq sizə kömək etmək üçün min nəfər mələk vədini müjdə olsun deyə verdi, (وَلِتَطْمَئِنَّ بِهِ قُلُوبُكُمْ) – və bir də o müjdə səbəbi ilə qəlbləriniz aram olsun** (deyə verdi)**, amma güman etməyin ki, kömək, həqiqətən, mələklərdəndir, bəlkə, həqiqi kömək Allah-Təala tərəfindəndir. (وَمَا النَّصْرُ إِلَّا مِنْ عِنْدِ اللهِ إِنَّ اللهَ عَزِيزٌ حَكِيمٌ) – həqiqətən, Allah-Təala hər bir şeyə qalib və hakim, öz tədbirində də hikmət sahibidir.** (Hz. Peyğəmbərin səhabəsi nə qədər ki, qorxu içində idi, yata bilmirdi. Elə ki onlara yardım və qələbə müjdəsi verildi, qəlbləri aram olub yatdılar. O yerdə ki, onlar durmuşdular, qumluq bir yer idi. Hərəkət etmələri çətin idi, içməyə suları da yox idi. Susuzluq onlara qalib gəldi, müşriklər də onlardan qabaq gəlib su quyularını ələ keçirmişdilər. Şeytan (xəbis nəfsi-əmmarə) onlara vəsvəsə etdi ki, əgər sizin dininiz haqdırsa, niyə susuz qalıb, istidən ölürsünüz? Allah-Təala onlara yağış göndərdi. Həm yerləri yaxşı oldu, çünki qumluq yerə yağış dəyəndə möhkəm olur və həm də hövzələr qayırıb, heyvanlarını suvarıb, özləri də içmiş oldular. Necə ki sıradakı ayədə xəbər verir).

**11) (إِذْ يُغَشِّيكُمُ النُّعَاسَ أَمَنَةً مِنْهُ) – o zamanı yadınıza salın ki, düşmənin qorxusundan yata bilmirdiniz, amma Allah-Təala tərəfindən gələn kömək səbəbi ilə xatircəm olub sizi yuxu tutdu. (وَيُنَزِّلُ عَلَيْكُمْ مِنَ السَّمَاءِ مَاءً) – Allah-Təala səmadan sizə su göndərdi. (لِيُطَهِّرَكُمْ بِهِ) – ta ki o su səbəbi ilə bədəninizdə olan çirkləri pak edəsiniz. (وَيُذْهِبَ عَنْكُمْ رِجْزَ الشَّيْطَانِ) – şeytanın vəsvəsəsini də** (Necə ki əvvəldə qeyd olundu) **sizdən aparsın. (وَلِيَرْبِطَ عَلَى قُلُوبِكُمْ) – o su səbəbi ilə qəlblərinizi möhkəm edib aram etsin. (وَيُثَبِّتَ بِهِ الْأَقْدَامَ) – ayaqlarınızı o yağış suyunun səbəbinə o qumluq yerdə möhkəm etsin.** (Qumluq yerə yağış düşəndə orada gəzmək çox rahat olur)**.**

**12) (إِذْ يُوحِي رَبُّكَ إِلَى الْمَلَائِكَةِ أَنِّي مَعَكُمْ)** – (ey Məhəmməd)**, o zaman sənin rəbbin Allah-Təala mələklərə vəhy etdi ki, mən sizinlə birlikdəyəm və sizə köməkçiyəm. (فَثَبِّتُوا الَّذِينَ آمَنُوا) – siz mələklər də mömin olan şəxsləri bu savaşda qüvvətli edin. (سَأُلْقِي فِي قُلُوبِ الَّذِينَ كَفَرُوا الرُّعْبَ) – əlbəttə, kafir və**

فَاضْرِبُوا فَوْقَ الْأَعْنَاقِ وَاضْرِبُوا مِنْهُمْ كُلَّ بَنَانٍ ﴿١٢﴾ ذَلِكَ بِأَنَّهُمْ شَاقُّوا اللَّهَ وَرَسُولَهُ وَمَنْ يُشَاقِقِ
اللَّهَ وَرَسُولَهُ فَإِنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ ﴿١٣﴾ ذَلِكُمْ فَذُوقُوهُ وَأَنَّ لِلْكَافِرِينَ عَذَابَ النَّارِ ﴿١٤﴾ يَا أَيُّهَا
الَّذِينَ آمَنُوا إِذَا لَقِيتُمُ الَّذِينَ كَفَرُوا زَحْفًا فَلَا تُوَلُّوهُمُ الْأَدْبَارَ ﴿١٥﴾ وَمَنْ يُوَلِّهِمْ يَوْمَئِذٍ دُبُرَهُ إِلَّا
مُتَحَرِّفًا لِقِتَالٍ أَوْ مُتَحَيِّزًا إِلَى فِئَةٍ فَقَدْ بَاءَ بِغَضَبٍ مِنَ اللَّهِ وَمَأْوَاهُ جَهَنَّمُ وَبِئْسَ الْمَصِيرُ ﴿١٦﴾

---

**müşriklərin qəlblərinə qorxu salaram ki, sizdən qorxsunlar.** (فَاضْرِبُوا فَوْقَ الْأَعْنَاقِ) **– ey möminlər, savaşda kafirlərin boyunlarının üstündən vurun ki, onlardan ötrü ümid, nicat olmasın.** (وَاضْرِبُوا مِنْهُمْ كُلَّ بَنَانٍ) **– onların bütün barmaqlarını vurub kəsin.** (Belə ki əllərində qılınc və digər hərb alətlərini tutmağa gücləri olmasın)**.**

**13)** (ذَلِكَ بِأَنَّهُمْ شَاقُّوا اللَّهَ وَرَسُولَهُ) **– müşriklərə bu əzab və qətl onların Allah-Təalanı və onun peyğəmbərini düşmən saydıqları üçündür.** (وَمَنْ يُشَاقِقِ اللَّهَ وَرَسُولَهُ) **– kim Allah-Təalanı və onun peyğəmbərini düşmən saysa,** (فَإِنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ) **– həqiqətən, Allah-Təalanın onlara olan əzabı çox şiddətli olacaqdır.**

**14)** (ذَلِكُمْ فَذُوقُوهُ) **– siz kafirlər möminlərin əlində zəlil olmaqla dünya əzabını dadın.** (وَأَنَّ لِلْكَافِرِينَ عَذَابَ النَّارِ) **– və həqiqətən, kafirlərdən ötrü axirətdə də cəhənnəm odunun əzabı vardır.**

**15)** (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) **– ey iman gətirənlər,** (إِذَا لَقِيتُمُ الَّذِينَ كَفَرُوا زَحْفًا) **– elə ki kafirlər çox və siz az olduğunuz halda, onlarla qarşılaşdınız,** (فَلَا تُوَلُّوهُمُ الْأَدْبَارَ) **– qaçmaqdan ötrü onlara arxanızı çevirməyin, gərək, savaşda qüvvətli olasınız.**

**16)** (وَمَنْ يُوَلِّهِمْ يَوْمَئِذٍ دُبُرَهُ) **– kim cihad edəndə qaçmaq üçün arxasını kafirlərə çevirsə,** (إِلَّا مُتَحَرِّفًا لِقِتَالٍ أَوْ مُتَحَيِّزًا إِلَى فِئَةٍ) **– savaşda kafirlərə arxa çevirmək caiz deyil, böyük günahdır. Ancaq düşməni aldadıb yenidən savaşa qayıtmaq, ya da** (kömək üçün) **bu dəstədən o biri dəstəyə qoşulan vaxtlarda arxa çevirmək caizdir.** (فَقَدْ بَاءَ بِغَضَبٍ مِنَ اللَّهِ) **– bu səbəblərdən başqa savaşa arxa çevirən şəxs həqiqətən Allah-Təalanın qəzəbinə düçar olaraq savaşdan qaçmış olar.** (وَمَأْوَاهُ جَهَنَّمُ وَبِئْسَ الْمَصِيرُ) **– o şəxsin axirətdəki məskəni cəhənnəmdir, nə pis dönüləcək yerdir cəhənnəm.** (elə ki savaş olub, Məkkə əhlini məğlub etdilər, bir qismi öldürülüb, bir qismi də əsir düşdü, müsəlmanlar fəxr etməyə başladılar, biri deyirdi: "Əbu Cəhli mən qətlə yetirdim," o biri deyirdi: "Utbəni mən öldürdüm,". Savaşdan qabaq Hz. Peyğəmbər min nəfərlik şücaətli Qüreyş ordusunu görəndən sonra dönüb öz camaatına baxdı, dedi: "İlahi, mənə vəd edibsən ki, bizə kömək edəcəksən, ilahi, vədinə vəfa et," ondan sonra Hz. Peyğəmbər buyurdu: "Ey Əli, mənə bir ovuc torpaq ver". Hz. Əli bir ovuc torpağı Hz. Peyğəmbərə verdi, Hz. Peyğəmbər də o bir ovuc torpağı

فَلَمْ تَقْتُلُوهُمْ وَلَكِنَّ اللَّهَ قَتَلَهُمْ وَمَا رَمَيْتَ إِذْ رَمَيْتَ وَلَكِنَّ اللَّهَ رَمَى وَلِيُبْلِيَ الْمُؤْمِنِينَ مِنْهُ بَلَاءً حَسَنًا

إِنَّ اللَّهَ سَمِيعٌ عَلِيمٌ ﴿١٧﴾ ذَلِكُمْ وَأَنَّ اللَّهَ مُوهِنُ كَيْدِ الْكَافِرِينَ ﴿١٨﴾ إِنْ تَسْتَفْتِحُوا فَقَدْ جَاءَكُمُ

الْفَتْحُ وَإِنْ تَنْتَهُوا فَهُوَ خَيْرٌ لَكُمْ وَإِنْ تَعُودُوا نَعُدْ وَلَنْ تُغْنِيَ عَنْكُمْ فِئَتُكُمْ شَيْئًا وَلَوْ كَثُرَتْ

---

Qüreyş ordusuna tərəf atıb buyurdu: "Qaralsın bu üzlər". O torpaq Qüreyş ordusunun üstünə saçılıb, hər birinin gözünə o torpağın tozu daxil oldu. Elə ki Qüreyş ordusu məğlub oldu, səhabələr belə dedilər: "Hz. Peyğəmbərin torpaq saçması müşriklərin məğlubiyyətinə səb0əb oldu". Allah-Təala gələn ayədə Hz. Peyğəmbərin torpaq saçmasının müşriklərin dağılmasına və müsəlmanların müşrikləri qətlə yetirməsinə səbəb olduğu fikrini rədd edir).

**17)** (فَلَمْ تَقْتُلُوهُمْ وَلَكِنَّ اللَّهَ قَتَلَهُمْ) – **müşrikləri siz müsəlmanlar qətlə yetirdiniz, amma, əslində, siz qətlə yetirmədiniz, bəlkə, Allah-Təala onları qətlə yetirdi. Çünki yardım və qələbə Allah-Təaladandır.** (وَمَا رَمَيْتَ إِذْ رَمَيْتَ وَلَكِنَّ اللَّهَ رَمَى) – (ey Məhəmməd), **müşriklərin gözünə tökülən o torpağı hərçənd zahirdə sən atdın, amma, əslində, sən atmadın. Bəlkə, həqiqətən o torpağı Allah-Təala atdı.** (Çünki bir ovuc torpağın min nəfər camaatın gözünə tökülməsi insan işi deyil, bəlkə, belə iş Allah-Təalanın işidir). (وَلِيُبْلِيَ الْمُؤْمِنِينَ مِنْهُ بَلَاءً حَسَنًا) – **Allah-Təala öz tərəfindən möminlərə gözəl ehsan etməkdən ötrü müşrikləri məğlub etdi.** (إِنَّ اللَّهَ سَمِيعٌ عَلِيمٌ) – **həqiqətən, Allah-Təala möminlərin dualarını eşidib, onların əhvalından agahdır.**

**18)** (ذَلِكُمْ) – **müşrikləri məğlub etməkdə Allah-Təalanın məqsədi budur ki, siz möminlərə mərhəmət və ehsan etsin.** (وَأَنَّ اللَّهَ مُوهِنُ كَيْدِ الْكَافِرِينَ) – **həqiqətən, Allah-Təala kafirlərin məkr və hiylələrini zəiflədəndir.** (Məkkə əhli savaşa getmədən əvvəl onların böyükləri Kəbədə cəm olub Kəbənin pərdəsindən yapışıb dedilər: "İlahi, biz Məhəmmədin davasına gedirik, bizimlə Məhəmməddən hansımız qonağa və qohuma ehtiram və yaxşılıq edib, məzlumlara kömək edəndirsə, ona kömək et, əgər Məhəmməd haqlıdırsa, ona kömək et, əgər biz haqlı, Məhəmməd batildirsə, bizə kömək et. Bu barədə sıradakı ayədə Məkkə əhlinə xitab edilir:)

**19)** (إِنْ تَسْتَفْتِحُوا فَقَدْ جَاءَكُمُ الْفَتْحُ) – **ey Məkkə əhli, əgər siz Allah-Təaladan fəth və qələbə istəyirsinizsə, artıq həqiqətən sizdən ötrü fəth və qələbə gəldi, sizin üçün daha bundan yaxşı fəth və qələbə olmaz.** (Bu söz kafirlərə tənə və istehzadır). (وَإِنْ تَنْتَهُوا فَهُوَ خَيْرٌ لَكُمْ) – **əgər peyğəmbərə ədavətinizdən, onunla savaşmaqdan əl çəksəniz, əlbəttə, bu, sizdən ötrü daha yaxşıdır.** (وَإِنْ تَعُودُوا نَعُدْ) – **amma əgər siz yenidən savaşa qayıtsanız, biz də peyğəmbərə kömək etmək üçün qayıdıb, sizi zəlil edərik.** (وَلَنْ تُغْنِيَ عَنْكُمْ فِئَتُكُمْ شَيْئًا وَلَوْ كَثُرَتْ) – **ey kafirlər, qoşununuz çox olsa da, yenə də sizi Allah-Təaladan ehtiyac-**

وَأَنَّ اللَّهَ مَعَ الْمُؤْمِنِينَ ﴿١٩﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا أَطِيعُوا اللَّهَ وَرَسُولَهُ وَلَا تَوَلَّوْا عَنْهُ وَأَنْتُمْ تَسْمَعُونَ
﴿٢٠﴾ وَلَا تَكُونُوا كَالَّذِينَ قَالُوا سَمِعْنَا وَهُمْ لَا يَسْمَعُونَ ﴿٢١﴾ إِنَّ شَرَّ الدَّوَابِّ عِنْدَ اللَّهِ الصُّمُّ
الْبُكْمُ الَّذِينَ لَا يَعْقِلُونَ ﴿٢٢﴾ وَلَوْ عَلِمَ اللَّهُ فِيهِمْ خَيْرًا لَأَسْمَعَهُمْ وَلَوْ أَسْمَعَهُمْ لَتَوَلَّوْا وَهُمْ
مُعْرِضُونَ ﴿٢٣﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اسْتَجِيبُوا لِلَّهِ وَلِلرَّسُولِ إِذَا دَعَاكُمْ لِمَا يُحْيِيكُمْ وَاعْلَمُوا أَنَّ اللَّهَ
يَحُولُ بَيْنَ الْمَرْءِ وَقَلْبِهِ وَأَنَّهُ إِلَيْهِ تُحْشَرُونَ ﴿٢٤﴾ وَاتَّقُوا فِتْنَةً لَا تُصِيبَنَّ الَّذِينَ ظَلَمُوا مِنْكُمْ خَاصَّةً

---

**sız etməz,** (bəlanı sizdən dəf etməz). **(وَأَنَّ اللَّهَ مَعَ الْمُؤْمِنِينَ) – həqiqətən, Allah-Təala möminlərlə olub, onlara kömək edəndir.**

**20) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirənlər, (أَطِيعُوا اللَّهَ وَرَسُولَهُ) – Allah-Təalaya və onun peyğəmbərinə** (Hz. Məhəmmədə) **itaət edin. (وَلَا تَوَلَّوْا عَنْهُ وَأَنْتُمْ تَسْمَعُونَ) – bir halda ki, onun sözlərini eşidib təsdiq edirsiniz, Allah-Təaladan üz döndərib, onun itaətindən çıxmayın, ondan necə üz döndərərsiniz?**

**21) (وَلَا تَكُونُوا كَالَّذِينَ قَالُوا سَمِعْنَا) –** (ey möminlər), **- Allah-Təalanın sözlərini eşidib təsdiq etdik, deyən şəxslər kimi olmayın. (وَهُمْ لَا يَسْمَعُونَ) – halbuki eşitməyib,** (təsdiq də etməyiblər, təsdiq etmənin qaydası əməl etməkdir. Əməl olmayanda təsdiq də yalandır).

**22)(إِنَّ شَرَّ الدَّوَابِّ عِنْدَ اللَّهِ) – həqiqətən, Allah-Təala qatında yer üzündə hərəkət edən ruh sahiblərinin ən pisi, (الصُّمُّ الْبُكْمُ الَّذِينَ لَا يَعْقِلُونَ) – o şəxslərdir ki, haqqı eşitməkdən qulaqları kar, haqqı deməkdən dilləri lal, özləri də ağılla hərəkət etməyənlərdir.**

**23) (وَلَوْ عَلِمَ اللَّهُ فِيهِمْ خَيْرًا لَأَسْمَعَهُمْ) –** (ey Məhəmməd), **əgər Allah-Təala onlarda bir xeyir** (Haqq-Təala tərəfinə hidayət tapmaq) **bilsəydi, əlbəttə, onlara haqq sözləri eşitdirərdi. (وَلَوْ أَسْمَعَهُمْ لَتَوَلَّوْا وَهُمْ مُعْرِضُونَ) – əgər haqq sözləri onlara eşitdirsəydi də, hər halda üz döndərib itaətdən çıxardılar.**

**24) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirənlər, (اسْتَجِيبُوا لِلَّهِ وَلِلرَّسُولِ إِذَا دَعَاكُمْ لِمَا يُحْيِيكُمْ) – nə zaman Allah-Təala və onun peyğəmbəri** (Hz. Məhəmməd) **sizin din və dünyanıza həyat verən işdən** (cihaddan) **ötrü sizi çağırsa, əlbəttə ki, qəbul edin. (وَاعْلَمُوا أَنَّ اللَّهَ يَحُولُ بَيْنَ الْمَرْءِ وَقَلْبِهِ) – ey insanlar, elə vaxt gələr ki, Allah-Təala şəxsin özüylə qəlbinin arasına girər, ölüm ona gələr, daha fürsət tapa bilməz, nə qədər ki fürsətiniz var, Allah-Təalaya itaət edin. (وَأَنَّهُ إِلَيْهِ تُحْشَرُونَ) – həqiqətən, hamınız Allah-Təalanın tərəfinə cəm olacaqsınız.**

**25) (وَاتَّقُوا فِتْنَةً لَا تُصِيبَنَّ الَّذِينَ ظَلَمُوا مِنْكُمْ خَاصَّةً) – qorxun o günahdan** (millət arasına* təfriqə salmaqdan)

**وَاعْلَمُوا أَنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ ﴿٢٥﴾ وَاذْكُرُوا إِذْ أَنْتُمْ قَلِيلٌ مُسْتَضْعَفُونَ فِي الْأَرْضِ تَخَافُونَ أَنْ يَتَخَطَّفَكُمُ النَّاسُ فَآوَاكُمْ وَأَيَّدَكُمْ بِنَصْرِهِ وَرَزَقَكُمْ مِنَ الطَّيِّبَاتِ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٢٦﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَخُونُوا اللَّهَ وَالرَّسُولَ وَتَخُونُوا أَمَانَاتِكُمْ وَأَنْتُمْ تَعْلَمُونَ ﴿٢٧﴾**

---

*(*Qeyd: Həqiqətən, müsəlmanlar arasında ixtilaf və ayrılıq salmaqdan böyük günah yoxdur. Bu dövrdə müsəlmanlar arasında ixtilafı salan şəxslərə Allah-Təala necə əzab edəcəkdir, özü bilir. Müsəlmanların rəhbərlərinin lazımınca səy və cəhd edib ümmət içində olan ixtilaf və nifaqı yox etməsi bu gün hər bir şeydən vacibdir. Bəs hələ o vaxt yetişməyibdir ki, bütün müsəlmanlar əl-ələ verib Qurani-Şərifin buyurduğu "bütün möminlər qardaşdır" (Hucurat, 49/10) fərmanını yadlarına salıb qədim əhd və məhəbbətlərini təzələsinlər? Bəs o zaman hələ gəlməyib ki, müsəlman qardaşlar şiə-sünni davasını bir kənara qoyub bir kitab, bir din, bir peyğəmbər və bir məzhəbdə ittifaq etsinlər? Və bu nifaqın xəbis sözlərini tərk edib ittihadi-İslamı seçib bir olsunlar? Qurani-Kərimin ehkamı əvvəldən axıradək bizləri ittihad və ittifaqa, birliyə çağırır. Bəs biz müsəlmanları bu nə bəladır tutub? Bunun səbəbi Qurani-Şərifin ehkamını atıb öz xəyalımızla düzəltdiyimiz sözlərə tabe olmaq deyilmi? Amma heyif, islam ümməti Qurani-Şərifin dərin mənalarına qafil olub, özgə millətlərin ittifaqına baxıb həsrət çəkirlər, halbuki dərdin dərmanı özlərindədir, dərmandan ötrü özgə yerlərə getməyə ehtiyac yoxdur. Qurani-Şərifin hər bir kəlməsi qaranlıqları aydınladan minlərlə çırağı, nurlu gövhəri ehtiva edir, amma gözlər görməkdən məhrumdur, gərək, bu qulağı, bu gözü və bu şüuru dəyişdirib əvəzində eşidən qulaq, uzaq görən göz, dərk edən şüur, fəhm əldə edək ki, Qurani-Şərifin dərin mənalarından faydalana bilək).*

ki, o günahın əzabı sizlərdən sadəcə zalımlara yetişməz, bəlkə, o elə bir günahdır ki, onun əzabı hamınızı tutar). **(وَاعْلَمُوا أَنَّ اللَّهَ شَدِيدُ الْعِقَابِ) – bilin və xəbərdar olun, həqiqətən, Allah-Təalanın** (islamda ixtilaf salanlara) **əzabı şiddətli və möhkəm olacaqdır.**

**26) (وَاذْكُرُوا إِذْ أَنْتُمْ قَلِيلٌ مُسْتَضْعَفُونَ فِي الْأَرْضِ)** – (ey möminlər), **o zamanı yadınıza salın ki, Məkkədə müşriklərin arasında az və zəif olan bir camaat idiniz. (تَخَافُونَ أَنْ يَتَخَطَّفَكُمُ النَّاسُ) – Məkkə əhlinin sizi həlak etməsindən qorxurdunuz. (فَآوَاكُمْ) – Allah-Təala sizə istirahət məskəni verib, sizi Mədinəyə gətirdi. (وَأَيَّدَكُمْ بِنَصْرِهِ) – həmin Bədir savaşında sizə kömək etdi. (وَرَزَقَكُمْ مِنَ الطَّيِّبَاتِ)** – (Bədir savaşında) **pak olan qənimətdən sizə ruzi verdi. (لَعَلَّكُمْ تَشْكُرُونَ) – əlbəttə, gərək, bu nemətlərə şükür edəsiniz.**

**27) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirənlər, (لَا تَخُونُوا اللَّهَ وَالرَّسُولَ) – Allah-Təalanın vacib etdiyi şeyləri tərk edib, peyğəmbərin** (Hz. Məhəmmədin) **qoyduğu yoldan çıxıb, cihadda aldığınız qənimətə xəyanət eyləməyin. (وَتَخُونُوا أَمَانَاتِكُمْ) – aranızda olan əmanətlərə də xəyanət etməyin, əlbəttə, əmanəti mühafizə edib sahibinə çatdırın. (وَأَنْتُمْ تَعْلَمُونَ) – və xəyanət etməyin**

وَاعْلَمُوا أَنَّمَا أَمْوَالُكُمْ وَأَوْلَادُكُمْ فِتْنَةٌ وَأَنَّ اللَّهَ عِنْدَهُ أَجْرٌ عَظِيمٌ ﴿٢٨﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا إِنْ تَتَّقُوا اللَّهَ
يَجْعَلْ لَكُمْ فُرْقَانًا وَيُكَفِّرْ عَنْكُمْ سَيِّئَاتِكُمْ وَيَغْفِرْ لَكُمْ وَاللَّهُ ذُو الْفَضْلِ الْعَظِيمِ ﴿٢٩﴾

---

**günahını, cəzasını bilirsiniz ki, ondan ötrü Allah-Təala yanında nə qədər əzab vardır.**

**28) (وَاعْلَمُوا أَنَّمَا أَمْوَالُكُمْ وَأَوْلَادُكُمْ فِتْنَةٌ) – bilin və xəbərdar olun, həqiqətən, sizin mal və övladınız sizdən ötrü bəladır.** (İnsanı günaha salmağa bais olarlar. Mal və övlad sizə cihada getməkdə mane olmasın). **(وَأَنَّ اللَّهَ عِنْدَهُ أَجْرٌ عَظِيمٌ) – həqiqətən, Allah-Təala yanında böyük olan əcr vardır. O əcr mal və övladdan artıqdır. O əcri də ancaq din yolunda cihad etməklə tapmaq olar.**

**29) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirənlər, (إِنْ تَتَّقُوا اللَّهَ يَجْعَلْ لَكُمْ فُرْقَانًا) – əgər Allah-Təaladan qorxub ona itaət edib cihada getsəniz, küfrə qalib olub, haqla batil bir-birindən fərqlənib aralansın deyə Allah-Təala sizə öz yanından kömək edər. (وَيُكَفِّرْ عَنْكُمْ سَيِّئَاتِكُمْ وَيَغْفِرْ لَكُمْ) – cihad səbəbinə günahlarınızın üstünə pərdə salıb** (örtüb) **sizi bağışlayar. (وَاللَّهُ ذُو الْفَضْلِ الْعَظِيمِ) – Allah-Təala böyük lütf və ehsan sahibidir.** (Hz. Peyğəmbər Məkkədə olan dövrdə Mədinə əhlindən bir camaat Məkkəyə gedib ona iman gətirib beyət eylədilər, Məkkəli Qüreyş əhli islamın yayılmasından qorxdular. Darün-Nədvədə (şura məclisi) toplanıb Hz. Peyğəmbərin haqqında məşvərət etdilər. Bir qoca kişi ora daxil olub dedi: "Mən Məkkəyə gəlmiş Nəcdli bir şəxsəm, (təfsirçilər deyiblər ki, bu qoca kişi şeytan idi. Təəccüblüdür, Nəcdli bir adama şeytan demək nəyə lazımdır?), bir zəruri işdən ötrü burada toplandığınızı eşidib istədim ki, mən də bura gəlim ki, mənim rəyimdən də faydalana biləsiniz. Dedilər: "Çox gözəl". Başladılar məşvərət etməyə. Əbül-Büxtəri dedi: "Mənim rəyim belədir ki, Məhəmmədi tutub qollarını bağlayıb bir evə salaq, o evin qapısını möhkəm bağlayıb, orada onu həbs edək və kiçik bir deşik yeri qoyaq ki, oradan ona su və yemək verək. Ölənə qədər də orada qalsın". (Nəcdli) qoca dedi: "Bu doğru fikir deyil, onun qövmü və camaatı vardır, gəlib savaşıb, zorla onu ordan çıxararlar, başqa şey fikirləşin". Hişam ibn Amir dedi: "Mənim rəyim belədir ki, onu tutub qollarını bağlayın, bir dəvəyə mindirib, öz aranızdan qovun, buraxın biyabana getsin. Ya dəvə onu qətlə yetirər, ya da sağ-salamat bir yerə getsə də, daha ondan sizə bir zərər gəlməz". Qoca dedi: "Nə pis fikirdir, bəlkə, salamat qaldı? O zaman da gedib başqa bir camaatı başına toplayıb, gəlib sizə hakim olar". Əbu Cəhl dedi: "Mənim rəyim budur ki, hər bir qəbilə və camaatdan bir cavan seçib, hər birinə bir qılınc verəsiniz, Məhəmməd gecə yatanda onlar qəflətən onun üstünə tökülüb onu qətlə yetirsinlər. O vaxt onun qanı bütün qəbilələrin arasında bölünmüş olar. Tək bəni -Haşim qəbiləsi bütün Qüreyş qəbilələrinə qarşı çıxıb savaşa bilməzlər. Əgər bizdən diyətini istəsələr, diyətini verib rahat olarıq". Nəcdli qoca dedi: "Bu cavan doğru dedi,

**وَإِذْ يَمْكُرُ بِكَ الَّذِينَ كَفَرُوا لِيُثْبِتُوكَ أَوْ يَقْتُلُوكَ أَوْ يُخْرِجُوكَ وَيَمْكُرُونَ وَيَمْكُرُ اللهُ وَاللَّهُ خَيْرُ الْمَاكِرِينَ ﴿٣٠﴾ وَإِذَا تُتْلَى عَلَيْهِمْ آيَاتُنَا قَالُوا قَدْ سَمِعْنَا لَوْ نَشَاءُ لَقُلْنَا مِثْلَ هَذَا إِنْ هَذَا إِلَّا أَسَاطِيرُ الْأَوَّلِينَ ﴿٣١﴾**

---

gözəl rəydir". Əbu Cəhlin rəyini qəbul edib dağıldılar. Bu əhvalat Allah-Təala tərəfindən Hz. Peyğəmbərə xəbər verilib Mədinəyə hicrət etməsinə izin verildi. Qüreyşin Hz. Peyğəmbəri öldürmək üçün toplandığı gecə Hz. Peyğəmbər Hz. Əlini öz yerinə qoyub getdi. Qüreyş müşrikləri Hz. Peyğəmbəri öldürmək üçün gecə onun evinə hücum etdilər. Qəfildən Hz. Əli əlində qılınc yataqdan qalxıb Qüreyşlilərə belə dedi: "Nə istəyirsiniz?" Dedilər: "Məhəmmədi istəyirik, hanı Məhəmməd?" Hz. Əli buyurdu: "Mən onun keşikçisi deyiləm, bilmirəm haradadır". Hamısı çaşıb, çıxıb getdilər. Bədir savaşından sonra Allah-Təala bu əhvalatı, Qüreyşin məkr və hiylələrini və Hz. Peyğəmbərin onlardan xilas olduğunu və Bədir savaşında onlara qalib gəldiyini sıradakı ayədə Hz. Peyğəmbərə xəbər verir. Belə ki müsəlmanlar bu böyük nemətlərə şükür edib, Allah-Təalanın islama necə kömək etdiyini görsünlər).

**30) (وَإِذْ يَمْكُرُ بِكَ الَّذِينَ كَفَرُوا)** – (ey Məhəmməd)**, o zamanı yadına sal ki, kafir olan Qüreyş camaatı Məkkədə sənə qarşı məkr, hiylə etdilər (لِيُثْبِتُوكَ) – ki, səni zindana salıb həbs etsinlər,** (Necə ki Əbül-Büxtəri dedi)**, (أَوْ يَقْتُلُوكَ) – ya da toplanıb səni qətlə yetirsinlər,** (Necə ki Əbu Cəhl dedi)**, (أَوْ يُخْرِجُوكَ وَيَمْكُرُونَ وَيَمْكُرُ اللهُ وَاللَّهُ خَيْرُ الْمَاكِرِينَ) – ya da səni ölkədən qovsunlar,** (Necə ki Hişam ibn Amir dedi)**, (وَيَمْكُرُونَ) – sənə qarşı qurduqları hiylələrini gizlətdilər ki, sənə zərər yetirsinlər. (وَيَمْكُرُ اللهُ) – Allah-Təala da onların məkr və hiylələrinin əvəzində onlardan ötrü hazırladığı əzabı gizlətdi ki, o əzabı qəfildən onlara yetirsin,** (Necə ki Bədir savaşında yetirdi)**. (وَاللَّهُ خَيْرُ الْمَاكِرِينَ) – Allah-Təala əzab vaxtına agah olub, onu gizlədənlərin ən yaxşısıdır.**

**31) (وَإِذَا تُتْلَى عَلَيْهِمْ آيَاتُنَا) – nə zaman ki müşriklərə bizim ayələrimiz oxundu, (قَالُوا قَدْ سَمِعْنَا لَوْ نَشَاءُ لَقُلْنَا مِثْلَ هَذَا) – dedilər ki,** (belə şeyləri çox) **eşitmişik, əgər biz də istəsək, əlbəttə, bu cür ayələr deyərik. (إِنْ هَذَا إِلَّا أَسَاطِيرُ الْأَوَّلِينَ) – bu sözlər ancaq keçmiş batil əhvalatlardır** (nağıllardır)**.** (Bu sözü deyən Nəzr ibnül-Haris idi, Qüreyş tayfasından olub, İrana gedib orada Rüstəm, İsfəndiyar hekayələrini öyrənib gəlmişdi. Bu sözü də məhz inadkarlığından dedi, yoxsa, həqiqətən, Quranın müqabilində söz deməyə gücü çatsaydı, hər halda deyib Quranı batil edərdi. Çünki Qüreyş tayfasının gecə-gündüz bütün fikri o idi ki, bəlkə, bir yol tapıb Quranı batil etsinlər. Çox səy etsələr də, heç bir fayda vermədi, Quranın ən kiçik bir surəsinin oxşarını da gətirməkdən də aciz qaldılar).

وَإِذْ قَالُوا اللَّهُمَّ إِنْ كَانَ هَذَا هُوَ الْحَقَّ مِنْ عِنْدِكَ فَأَمْطِرْ عَلَيْنَا حِجَارَةً مِنَ السَّمَاءِ أَوِ ائْتِنَا بِعَذَابٍ
أَلِيمٍ ﴿٣٢﴾ وَمَا كَانَ اللَّهُ لِيُعَذِّبَهُمْ وَأَنْتَ فِيهِمْ وَمَا كَانَ اللَّهُ مُعَذِّبَهُمْ وَهُمْ يَسْتَغْفِرُونَ ﴿٣٣﴾ وَمَا
لَهُمْ أَلَّا يُعَذِّبَهُمُ اللَّهُ وَهُمْ يَصُدُّونَ عَنِ الْمَسْجِدِ الْحَرَامِ وَمَا كَانُوا أَوْلِيَاءَهُ إِنْ أَوْلِيَاؤُهُ إِلَّا الْمُتَّقُونَ
وَلَكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ ﴿٣٤﴾ وَمَا كَانَ صَلَاتُهُمْ عِنْدَ الْبَيْتِ إِلَّا مُكَاءً وَتَصْدِيَةً فَذُوقُوا الْعَذَابَ
بِمَا كُنْتُمْ تَكْفُرُونَ ﴿٣٥﴾

---

**32) (وَإِذْ قَالُوا اللَّهُمَّ إِنْ كَانَ هَذَا هُوَ الْحَقَّ مِنْ عِنْدِكَ)** – (ey Məhəmməd)**, o zamanı yadına sal ki, Qüreyş camaatı belə dedi: "Ey bizim Allahımız, əgər bu Quran haqdırsa, sənin tərəfindən nazil olubdursa, (فَأَمْطِرْ عَلَيْنَا حِجَارَةً مِنَ السَّمَاءِ) – bizə səmadan daş yağdırıb həlak et. (أَوِ ائْتِنَا بِعَذَابٍ أَلِيمٍ) – ya da ondan başqa bizə şiddətli bir əzab yetir".**

**33) (وَمَا كَانَ اللَّهُ لِيُعَذِّبَهُمْ وَأَنْتَ فِيهِمْ)** – (ey Məhəmməd, Qüreyş camaatı belə dedi), **amma nə qədər ki, sən onların arasındasan, Allah-Təala Qüreyş camaatının bu sözlərinə görə onlara əzab edən deyil,** (sən onların arasından çıxanda, əlbəttə, onlara əzab edərəm. Necə ki Bədir savaşında əzab etdi). **(وَمَا كَانَ اللَّهُ مُعَذِّبَهُمْ وَهُمْ يَسْتَغْفِرُونَ) – yenə Allah-Təala onlar tövbə edib küfr və şirkdən dönsələr, onlara əzab etməz. Amma tövbə etməsələr, Allah-Təala onlara əzab edər.**

**34) (وَمَا لَهُمْ أَلَّا يُعَذِّبَهُمُ اللَّهُ وَهُمْ يَصُدُّونَ عَنِ الْمَسْجِدِ الْحَرَامِ)** – **yoxsa** (sən onların arasından ayrılandan sonra) **Allah-Təalanın onlara əzab etməsinə nə əngəl vardır və həm də onlar xalqın Məscidül-harama daxil olub tavaf etməsinə mane olurlar.** (Ey Məhəmməd, necə ki sənin özünə və səhabələrinə Hüdeybiyyədə mane oldular, belə şəxslər əlbəttə, əzaba layiqdirlər). **(وَمَا كَانُوا أَوْلِيَاءَهُ) – heç vaxt onlar Allah-Təalaya dost olmayıb və olmazlar. (إِنْ أَوْلِيَاؤُهُ إِلَّا الْمُتَّقُونَ) – Allah-Təalanın dostları ancaq müttəqi,** (şərdən) **çəkinən və doğru olan müsəlmanlardır, nəinki adlarını müsəlman qoyanlardır. (وَلَكِنَّ أَكْثَرَهُمْ لَا يَعْلَمُونَ) – amma onların çoxu bunu bilmirlər cahildirlər.**

**35) (وَمَا كَانَ صَلَاتُهُمْ عِنْدَ الْبَيْتِ إِلَّا مُكَاءً وَتَصْدِيَةً) –müşriklərin namazı Kəbədə ibadət yerinə ancaq səs salıb əl çalmaqdan başqa bir şey deyil.** (Cahiliyyə zamanında Kəbəni tavaf edəndə kişi və qadınlar lüt soyunub, səs salıb, əl çalıb dəstə-dəstə tavaf edərdilər, Hz. Peyğəmbər təbliğə başlayandan sonra nə vaxt gəlib Kəbədə namaz qılsa, onlar bu əməllərinə başlayardılar. Ta ki Hz. Peyğəmbərin namazını pozsunlar. Bu əməl onların arasında bir müddət davam etdi. Elə ki Hz. Peyğəmbər hicrətin 8-ci ilində Məkkəni fəth etdi, onun əmri ilə bu əməl batil sayılıb tərk olundu). **(فَذُوقُوا الْعَذَابَ بِمَا كُنْتُمْ تَكْفُرُونَ)** – (ey müşriklər)**, Quranı inkar etdiyiniz üçün Bədir gününün əzabını dadın.**

إِنَّ الَّذِينَ كَفَرُوا يُنْفِقُونَ أَمْوَالَهُمْ لِيَصُدُّوا عَنْ سَبِيلِ اللهِ فَسَيُنْفِقُونَهَا ثُمَّ تَكُونُ عَلَيْهِمْ حَسْرَةً ثُمَّ يُغْلَبُونَ
وَالَّذِينَ كَفَرُوا إِلَى جَهَنَّمَ يُحْشَرُونَ ﴿٣٦﴾ لِيَمِيزَ اللهُ الْخَبِيثَ مِنَ الطَّيِّبِ وَيَجْعَلَ الْخَبِيثَ بَعْضَهُ عَلَى
بَعْضٍ فَيَرْكُمَهُ جَمِيعًا فَيَجْعَلَهُ فِي جَهَنَّمَ أُولَئِكَ هُمُ الْخَاسِرُونَ ﴿٣٧﴾ قُلْ لِلَّذِينَ كَفَرُوا إِنْ يَنْتَهُوا
يُغْفَرْ لَهُمْ مَا قَدْ سَلَفَ وَإِنْ يَعُودُوا فَقَدْ مَضَتْ سُنَّةُ الْأَوَّلِينَ ﴿٣٨﴾ وَقَاتِلُوهُمْ حَتَّى لَا تَكُونَ فِتْنَةٌ
وَيَكُونَ الدِّينُ كُلُّهُ لِلهِ فَإِنِ انْتَهَوْا فَإِنَّ اللهَ بِمَا يَعْمَلُونَ بَصِيرٌ ﴿٣٩﴾ وَإِنْ تَوَلَّوْا فَاعْلَمُوا أَنَّ اللهَ مَوْلَاكُمْ

---

**36) (إِنَّ الَّذِينَ كَفَرُوا)** – (ey Məhəmməd), **həqiqətən, kafir olan şəxslər, (يُنْفِقُونَ أَمْوَالَهُمْ لِيَصُدُّوا عَنْ سَبِيلِ اللهِ) – xalqın Allah-Təala yoluna gəlib islam dininə daxil olmasına mane olmaq üçün mallarını sərf edərlər, (أَصْحَابَ) – bəli, əlbəttə, mallarını Allah-Təala yolundan döndərməkdən ötrü verərlər. (فَسَيُنْفِقُونَهَا ثُمَّ تَكُونُ عَلَيْهِمْ حَسْرَةً) – amma ondan sonra o verdikləri mal onlardan ötrü peşmançılıq olar. (ثُمَّ يُغْلَبُونَ) – onlara heç bir fayda verməyib, ondan sonra müsəlmanların əlində məğlub olarlar.** (Necə ki məğlub da oldular, hərçənd savaşlarda bəzən müsəlmanlar, bəzən də müşriklər qələbə çalırdı, amma axırda müsəlmanlar qalib gəldilər). **(وَالَّذِينَ كَفَرُوا إِلَى جَهَنَّمَ يُحْشَرُونَ) – kafir olanlar axirətdə tamamən cəhənnəm tərəfinə cəm olub, onlardan ötrü heç vaxt nicat olmayacaqdır.**

**37) (لِيَمِيزَ اللهُ الْخَبِيثَ مِنَ الطَّيِّبِ) – Allah-Təala kafir və müşrikləri cəhənnəmə aparar ki, xəbis olan şəxsləri pak olan şəxslərdən ayırd etsin, (وَيَجْعَلَ الْخَبِيثَ بَعْضَهُ عَلَى بَعْضٍ) – və xəbislərin bəzisini də digərlərinin yanına yığıb, (فَيَرْكُمَهُ جَمِيعًا) – hamısını bir-birinin üstünə toplasın. ( فَيَجْعَلَهُ فِي جَهَنَّمَ) – ondan sonra hamısını tamamən cəhənnəmə atsın. (أُولَئِكَ هُمُ الْخَاسِرُونَ) – əlbəttə, onlar özlərinə ziyankar olanlardır.**

**38) (قُلْ لِلَّذِينَ كَفَرُوا إِنْ يَنْتَهُوا يُغْفَرْ لَهُمْ مَا قَدْ سَلَفَ)** – (ey Məhəmməd), **kafirlərə de ki, əgər səninlə düşmənçilik etməyib savaşmasalar, onda onların keçmiş günahları bağışlanar. (وَإِنْ يَعُودُوا فَقَدْ مَضَتْ سُنَّةُ الْأَوَّلِينَ) – əgər yenidən səninlə savaşmağa qayıtsalar, həqiqətən onlardan qabaq keçən şəxslər üçün təyin edilən yol** (Bədir savaşında əsir olmaq və öldürülmək) **bunlardan ötrü də olacaqdır. Hamısı dünyada zəlil və axirətdə əzab içində olacaqdırlar.**

**39) (وَقَاتِلُوهُمْ حَتَّى لَا تَكُونَ فِتْنَةٌ) – ey möminlər, əgər müşriklər sizinlə savaşmaq üçün qayıtsalar, siz də onlarla savaşın ki, birdəfəlik şirki götürüb müşrikləri yox edəsiniz, (وَيَكُونَ الدِّينُ كُلُّهُ لِلهِ) – və din də ancaq Allah-Təalaya məxsus olub şirk məhv olsun. (فَإِنِ انْتَهَوْا فَإِنَّ اللهَ بِمَا يَعْمَلُونَ بَصِيرٌ) – əgər küfrdən dönüb islama gəlsələr, həqiqətən, Allah-Təala onların əməllərindən və tövbələrindən agahdır, niyyətlərinə görə onlara mükafat verəcəkdir.**

**40) (وَإِنْ تَوَلَّوْا) – əgər müşriklər üz döndərib, itaət etməyib, islama daxil olmasalar, (فَاعْلَمُوا أَنَّ اللهَ مَوْلَاكُمْ)** – (ey möminlər), **bilin ki, həqiqətən Allah-**

نِعْمَ الْمَوْلَى وَنِعْمَ النَّصِيرُ ﴿٤٠﴾ وَاعْلَمُوا أَنَّمَا غَنِمْتُمْ مِنْ شَيْءٍ فَأَنَّ لِلَّهِ خُمُسَهُ وَلِلرَّسُولِ وَلِذِي الْقُرْبَى وَالْيَتَامَى وَالْمَسَاكِينِ وَابْنِ السَّبِيلِ إِنْ كُنْتُمْ آمَنْتُمْ بِاللَّهِ وَمَا أَنْزَلْنَا عَلَى عَبْدِنَا يَوْمَ الْفُرْقَانِ يَوْمَ الْتَقَى الْجَمْعَانِ وَاللَّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٤١﴾ إِذْ أَنْتُمْ بِالْعُدْوَةِ الدُّنْيَا وَهُمْ بِالْعُدْوَةِ الْقُصْوَى وَالرَّكْبُ أَسْفَلَ مِنْكُمْ

---

**Təala sizə dost, köməkçidir. Allah-Təalanın dostluğuna və yardımına etimad edin. (نِعْمَ الْمَوْلَى وَنِعْمَ النَّصِيرُ) – Allah-Təala nə yaxşı dost və nə yaxşı köməkçidir.**

**41) (وَاعْلَمُوا أَنَّمَا غَنِمْتُمْ مِنْ شَيْءٍ)** – (ey möminlər)**, bilin ki, həqiqətən, cihadda kafirlərdən qənimət aldığınız hər bir şeyin** (qənimət 5-də bir hissəyə (xümsə) ayrılır, yerdə qalanı cihad edənlərindir, o bir hissə isə gərək altı yerə bölünsün, necə ki buyurur:) **(فَأَنَّ لِلَّهِ خُمُسَهُ) – beşdə bir hissəsi Allah-Təala üçündür. (وَلِلرَّسُولِ) – bir hissə peyğəmbərdən ötrüdür.** (Allah-Təalanın hissəsi də peyğəmbərindir, o hissəni peyğəmbər müsəlmanlara lazım olan yerdə sərf edər, amma peyğəmbərdən sonra Allah-Təalanın və peyğəmbərin hissəsi gərək müsəlmanların ehtiyacı yönündə sərf edilsin), **(وَلِذِي الْقُرْبَى) – bir hissə də peyğəmbərin qohumlarından** (bəni-Haşim və bəni-Müttəlibdən)* **ötrüdür. (وَالْيَتَامَى) – bir hissə də müsəlmanların yetimlərindən ötrüdür. (وَالْمَسَاكِينِ) – bir hissə də müsəlmanların miskinlərindən ötrüdür. (وَابْنِ السَّبِيلِ) – bir hissə də vilayətlərinə yetişməmiş, pulları qurtaran müsafirlərdən ötrüdür,** (öz vilayətlərində zəngin də olsalar, onlara o hissəsdən o qədər pul verilməlidir ki, vilayətlərinə çata bilsinlər). (Qənimətin “xüms”ü (5-də bir hissəsi) gərək, bu 6 yerə bölünsün. Bu qeyd olunanlardan hər hansı biri əgər olmasa, onun hissəsi, gərək, müsəlmanlara lazım olan yerdə sərf olunsun. Bu hökm xüms barəsindədir. Bədir savaşından sonra qənimət əldə edən müsəlmanlar barəsində nazil olmuşdur, amma hökmü hər bir cihadda əldə edilən qənimətə şamildir). **(إِنْ كُنْتُمْ آمَنْتُمْ بِاللَّهِ وَمَا أَنْزَلْنَا عَلَى عَبْدِنَا يَوْمَ الْفُرْقَانِ يَوْمَ الْتَقَى الْجَمْعَانِ) – xüms barəsində hökm belədir. Əgər Allah-Təalaya və qulumuz Məhəmmədə haqla batil aralanan gündə və iki dəstə** (kafir və müsəlmanlar) **qarşılaşan gündə** (Bədir günündə) **nazil etdiyimiz o hökmlərə iman etmisinizsə, gərək, qənimətdə xümsü vacib biləsiniz. (وَاللَّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) – Allah-Təala hər bir şeyə qadirdir. Zəifi güclüyə, azı çoxa qalib etməyə qadirdir.** (Necə ki Bədir günündə qalib etdi, bunu növbəti ayələrdə xəbər verir).

*(*Qeyd: Müttəlib Haşimin qardaşıdır, Haşim və Müttəlib hər ikisi Əbdi-Manafın oğullarıdır).*

**42) (إِذْ أَنْتُمْ بِالْعُدْوَةِ الدُّنْيَا)** – (ey möminlər)**, o zamanı yadınıza salın ki, siz Bədir çölünün Mədinəyə yaxın olan kənarında idiniz, (وَهُمْ بِالْعُدْوَةِ الْقُصْوَى) – Qüreyş əhli də Bədirin Məkkəyə tərəf olan kənarında idilər. (وَالرَّكْبُ أَسْفَلَ مِنْكُمْ)**

وَلَوْ تَوَاعَدْتُمْ لَاخْتَلَفْتُمْ فِي الْمِيعَادِ وَلَكِنْ لِيَقْضِيَ اللَّهُ أَمْرًا كَانَ مَفْعُولًا لِيَهْلِكَ مَنْ هَلَكَ عَنْ بَيِّنَةٍ وَيَحْيَا مَنْ حَيَّ عَنْ بَيِّنَةٍ وَإِنَّ اللَّهَ لَسَمِيعٌ عَلِيمٌ ﴿٤٢﴾ إِذْ يُرِيكَهُمُ اللَّهُ فِي مَنَامِكَ قَلِيلًا وَلَوْ أَرَاكَهُمْ كَثِيرًا لَفَشِلْتُمْ وَلَتَنَازَعْتُمْ فِي الْأَمْرِ وَلَكِنَّ اللَّهَ سَلَّمَ إِنَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ ﴿٤٣﴾ وَإِذْ يُرِيكُمُوهُمْ إِذِ الْتَقَيْتُمْ فِي أَعْيُنِكُمْ قَلِيلًا

---

**– Qüreyşin Şamdan gələn karvanı sizdən aşağıda dəniz kənarından gedirdi.** (وَلَوْ تَوَاعَدْتُمْ لَاخْتَلَفْتُمْ فِي الْمِيعَادِ) **– əgər siz Qüreyş camaatıyla bir-birinizə vəd edib, savaşdan ötrü müəyyən bir vaxtı seçsəydiniz də, hər halda o vaxtda ixtilaf edib cəm olmazdınız. Amma Allah-Təala sizi vəd etmədən bir yerə cəm etdi ki, öz qüdrətini zahir etsin necə sizin kimi zəif, hazırlıqsız bir camaatı Qüreyş kimi güclü və hazırlıqlı bir camaata qalib edər? Bu, Allah-Təalanın qüdrəti deyilmi?** (وَلَكِنْ لِيَقْضِيَ اللَّهُ أَمْرًا كَانَ مَفْعُولًا) **– lakin Allah-Təala sizi vədələşmədən bu yerə cəm etdi ki, vacib saydığı əmri** (möminləri kafirlərə qalib etmək) **hökm edib onu əmələ gətirsin.** (لِيَهْلِكَ مَنْ هَلَكَ عَنْ بَيِّنَةٍ) **– Allah-Təala Bədir hadisəsini aşkar olan bir dəlil etdi ki, onu görəndən sonra küfrlə həlak olan dəlil üzrə həlak olsun, məlum olsun ki, o şəxs inadkardır.** (وَيَحْيَا مَنْ حَيَّ عَنْ بَيِّنَةٍ) **– sağ qalıb islamda sabit olan da, dəlil üzrə sağ qalsın. İslamın haqq olması ona tam aydın olsun.** (وَإِنَّ اللَّهَ لَسَمِيعٌ عَلِيمٌ) **– həqiqətən, Allah-Təala sizin sözlərinizi eşidib, niyyətlərinizə agah olandır.**

**43)** (إِذْ يُرِيكَهُمُ اللَّهُ فِي مَنَامِكَ قَلِيلًا) – (ey Məhəmməd)**, o zamanı yadına sal ki, Allah-Təala sənə yuxuda Qüreyş tayfasını az göstərmişdi, amma həqiqətdə onlar çox idilər.** (Hz. Peyğəmbər Bədir savaşından əvvəl yuxuda Qüreyş tayfasını az görüb, onlarla savaşıb qalib olmuşdu və o, bu yuxunu səhabəsinə xəbər verdi. Çünki peyğəmbərin yuxusu doğru olar, o səbəbdən səhabənin qəlbi aram oldu, onlar cəsarətləndilər. Doğru yuxunun haqq olmasına həmin ayə böyük dəlildir). (وَلَوْ أَرَاكَهُمْ كَثِيرًا لَفَشِلْتُمْ وَلَتَنَازَعْتُمْ فِي الْأَمْرِ) – (ey Məhəmməd)**, əgər Allah-Təala yuxuda Qüreyş camaatını sənə çox göstərsəydi, hər halda sizi qorxu bürüyüb, bir-birinizlə savaşda möhkəm olmaq, yoxsa qaçmaq haqqında mübahisə edərdiniz.** (وَلَكِنَّ اللَّهَ سَلَّمَ) **– lakin Allah-Təala o yuxu səbəbinə sizi qorxudan və bir-birinizlə münaqişə etməkdən salamat qurtardı** (إِنَّهُ عَلِيمٌ بِذَاتِ الصُّدُورِ) **– həqiqətən, Allah-Təala sinələrdə olan sirlərdən agahdır, qəlbinizdə savaş haqqında nə olduğunu bilir.**

**44)** (وَإِذْ يُرِيكُمُوهُمْ إِذِ الْتَقَيْتُمْ فِي أَعْيُنِكُمْ قَلِيلًا) – (ey möminlər, yadınıza salın o zamanı ki,) **Bədirdə Qüreyş tayfasıyla qarşılaşdığınızda, Allah-Təala onları sizin gözünüzə az göstərdi. (Hz. Peyğəmbərin yuxusunun təsdiqindən ötrü Qüreyş ordusu müsəlmanların gözündə az sayda göründü. Abdullah ibn Məsud deyir: “Elə ki müşriklərlə Bədir davasında qarşılaşdıq, yanım-**

وَيُقَلِّلُكُمْ فِي أَعْيُنِهِمْ لِيَقْضِيَ اللّهُ أَمْرًا كَانَ مَفْعُولًا وَإِلَى اللّهِ تُرْجَعُ الْأُمُورُ ﴿٤٤﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا
إِذَا لَقِيتُمْ فِئَةً فَاثْبُتُوا وَاذْكُرُوا اللّهَ كَثِيرًا لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٤٥﴾ وَأَطِيعُوا اللّهَ وَرَسُولَهُ وَلَا تَنَازَعُوا
فَتَفْشَلُوا وَتَذْهَبَ رِيحُكُمْ وَاصْبِرُوا إِنَّ اللّهَ مَعَ الصَّابِرِينَ ﴿٤٦﴾ وَلَا تَكُونُوا كَالَّذِينَ خَرَجُوا مِنْ
دِيَارِهِمْ بَطَرًا وَرِئَاءَ النَّاسِ

---

**da duran kişiyə dedim ki, necə bilirsən, bu camaat 70 nəfər olar?" Dedi: "Gərək 100 nəfər olsunlar". Ondan sonra elə ki qalib olduq, onlardan bir kişini əsir edib soruşduq: "Siz neçə nəfər idiniz?" Dedi: "Min nəfərə yaxın idik". (وَيُقَلِّلُكُمْ فِي أَعْيُنِهِمْ) – halbuki siz müsəlmanlar az idiniz, sizi də onların gözündə az göstərdi (لِيَقْضِيَ اللّهُ أَمْرًا كَانَ مَفْعُولًا) – ki, Allah-Təala olması gərəkən o işi** (möminlərin Qüreyşə qalib olmasını) **hökm edib onu əmələ gətirsin. (وَإِلَى اللّهِ تُرْجَعُ الْأُمُورُ) – bütün işlər Allah-Təala tərəfinə dönər. Sizin qalib olmağınız öz ixtiyarınızla deyildi. Əgər Allah-Təala sizə kömək etməsəydi, əlbəttə, məğlub olardınız.**

**45) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا) – ey iman gətirənlər, (إِذَا لَقِيتُمْ فِئَةً فَاثْبُتُوا) – savaş vaxtı kafirlərdən olan bir dəstə ilə qarşılaşdığınızda, möhkəm olub savaşdan qaçmayın. (وَاذْكُرُوا اللّهَ كَثِيرًا) – savaşda Allah-Təalanı * çox zikr edib, dua edib kömək istəyin. (لَعَلَّكُمْ تُفْلِحُونَ) – əlbəttə, o vaxt nicat tapıb düşmənə qalib olarsınız.**

*(*Qeyd: Bu ayə buna dəlildir ki, insan gərək heç bir məqamda Allah-Təalanı yaddan çıxarmasın. Son dərəcə qəm-qüssə və qorxu içində olsa da, hər bir şeydən qafil olsa da, Allah-Təalanı zikr etməkdən, gərək, qafil olmasın. Əmirəl-möminin Hz. Əlinin xütbələrinə, vəzlərinə bax ki, Siffin savaşında, ya da xaricilərlə olan savaşında, o cür şiddətli müharibə günlərində də Allah-Təaladan qafil olmayıb, Ona necə həmd-sənalar, xalqa necə öyüd-nəsihətlər edib və necə dərin mənalı, fəsih, bəliğ kəlamlar ortaya qoyubdur. Bəli, müvəhhid və mömin olan şəxsin xüsusiyyəti budur ki, gərək, bir an da Allah-Təaladan qafil olmasın).*

**46) (وَأَطِيعُوا اللّهَ وَرَسُولَهُ) – Allah-Təalaya və onun peyğəmbərinə** (Hz. Məhəmmədə) **itaət edin. (وَلَا تَنَازَعُوا فَتَفْشَلُوا) – bir-birinizlə münaqişə etməyin. O zaman öz aranızdakı işləriniz zəifləyib, daha düşmənə qalib ola bilməzsiniz, (وَتَذْهَبَ رِيحُكُمْ) – və qələbə yeli** (ruhu) **sizdən gedər. Allah-Təala daha sizə kömək etməz.** (Gəmilər əksəriyyətlə külək vasitəsilə dənizdə hərəkət edib gedərlər, o səbəbdən burada qələbə yeli deyilir, savaşda olan şəxsləri dənizdəki gəmiyə oxşadıb buyurur: "Bir-birinizlə münaqişə etməyin ki, qələbə yeli sizdən getməyib, nicat tapasınız"). **(وَاصْبِرُوا إِنَّ اللّهَ مَعَ الصَّابِرِينَ) – səbir edin, həqiqətən, Allah-Təala səbir edənlərlə birlikdədir və onlara köməkçidir.**

**47) (وَلَا تَكُونُوا كَالَّذِينَ خَرَجُوا مِنْ دِيَارِهِمْ بَطَرًا وَرِئَاءَ النَّاسِ)** – (ey möminlər), **Məkkədən təkəbbürlə və özlərini xalqa göstərmək üçün çıxan və sizinlə savaşmağa gələn Məkkə əhli kimi olmayın. Görün Allah-Təala təkəbbürlənmələrinin**

وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللَّهِ وَاللَّهُ بِمَا يَعْمَلُونَ مُحِيطٌ ﴿٤٧﴾ وَإِذْ زَيَّنَ لَهُمُ الشَّيْطَانُ أَعْمَالَهُمْ وَقَالَ لَا غَالِبَ لَكُمُ الْيَوْمَ مِنَ النَّاسِ وَإِنِّي جَارٌ لَكُمْ فَلَمَّا تَرَاءَتِ الْفِئَتَانِ نَكَصَ عَلَى عَقِبَيْهِ وَقَالَ إِنِّي بَرِيءٌ مِنْكُمْ إِنِّي أَرَى مَا لَا تَرَوْنَ إِنِّي أَخَافُ اللَّهَ وَاللَّهُ شَدِيدُ الْعِقَابِ ﴿٤٨﴾ إِذْ يَقُولُ الْمُنَافِقُونَ وَالَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ غَرَّ هَؤُلَاءِ دِينُهُمْ وَمَنْ يَتَوَكَّلْ عَلَى اللَّهِ فَإِنَّ اللَّهَ عَزِيزٌ حَكِيمٌ ﴿٤٩﴾

---

**əvəzində onlara nə bəla verdi?** (Əbu Süfyan Məkkədən xəbər göndərdi ki, karvan sağ-salamat qayıdıb gəlib, Məkkəyə geri dönün. Əbu Cəhl dedi: “Mən gərək Bədirə gedəm, orada şərab içəm və müğənnilər məndən ötrü nəğmə oxusunlar. Bütün ərəblər də bizim şan və şövkətimizi görsünlər”. Allah-Təala şərab əvəzinə onlara ölüm şərabını içirib, müğənnilərin əvəzinə növhə oxuyanlar onlara ağı oxudular. Məkkədə Bədir savaşından sonra Məkkədə elə bir ev yox idi ki, orada matəm qurulmasın. Təkəbbürlənməyin və tüğyan etməyin aqibəti budur). **(وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللَّهِ) – bir də Qüreyş camaatı xalqın islama girməsinə mane olarlar. (وَاللَّهُ بِمَا يَعْمَلُونَ مُحِيطٌ) – Allah-Təala müşriklərin etdiyi əməllərin hamısından tam agahdır, dünyada onları cəzalarına yetirdi. Axirətdə də cəzalarını verəcəkdir.**

**48) (وَإِذْ زَيَّنَ لَهُمُ الشَّيْطَانُ أَعْمَالَهُمْ) – şeytan** (xəbis nəfsi-əmmarə) **Bədir savaşında müşriklərin əməllərini** (peyğəmbərə düşmən olub, onunla savaşmağı) **öz nəzərlərində gözəl göstərən zaman, (وَقَالَ لَا غَالِبَ لَكُمُ الْيَوْمَ مِنَ النَّاسِ) – şeytan onlara dedi**(vəsvəsə etdi) **ki, xalqdan heç kim bu gün sizə qalib ola bilməz. (وَإِنِّي جَارٌ لَكُمْ) – sizin pənahınız mənəm, mən sizə kömək edərəm, (həqiqətən, şeytan – öz xəbis nəfsi-əmmarələri belə deyərək onların öz əməllərini özlərinə gözəl göstərib, onlara qüvvət verib, savaşa yönləndirdi), (فَلَمَّا تَرَاءَتِ الْفِئَتَانِ نَكَصَ عَلَى عَقِبَيْهِ) – o zaman ki hər iki dəstə bir-birinə göründü, şeytanın vəsvəsəsi batil olub onlara kömək olmayıb qaçdı** (xəbis nəfsi-əmmarə zəiflədi). **(وَقَالَ إِنِّي بَرِيءٌ مِنْكُمْ) – şeytan dedi: “Mən siz Qüreyşdən bezmişəm. (إِنِّي أَرَى مَا لَا تَرَوْنَ) – mən o şeyi - Allah-Təalanın qoşunu olan mələkləri** (ruhani gücü) **görürəm ki, siz görmürsünüz, (müsəlmanların ruh gücünü görüb, müşriklərin həyatından ümidini kəsib bezdi). (إِنِّي أَخَافُ اللَّهَ وَاللَّهُ شَدِيدُ الْعِقَابِ)** – (hərçənd Allahın dərgahından qovulsam da), **həqiqətən, Allah-Təaladan qorxuram, Allah-Təala şiddətli əzab edəndir”.**

**49) (إِذْ يَقُولُ الْمُنَافِقُونَ وَالَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ)** – (ey Məhəmməd), **o zaman ki siz Mədinədən Bədir tərəfinə çıxdınız, Mədinə əhlindən olan münafiqlər və qəlblərində küfr, nifaq xəstəliyi olanlar sizin haqqınızda dedilər: (غَرَّ هَؤُلَاءِ دِينُهُمْ) – “Bunları öz dinləri təkəbbürləndirib aldatdı”.** (Bu müsəlmanlar öz dinlərinə aldandılar ki, bizim dinimiz haqdır. Qüreyş tayfasının qarşısına çıxdılar, bunları əcəl ölümə aparır, Qüreyşin əlindən xilas olan deyildirlər). **(وَمَنْ يَتَوَكَّلْ عَلَى اللَّهِ فَإِنَّ اللَّهَ عَزِيزٌ حَكِيمٌ)** – (ey Məhəmməd), **münafiqlər sizdən ötrü belə**

وَلَوْ تَرَى إِذْ يَتَوَفَّى الَّذِينَ كَفَرُوا الْمَلَائِكَةُ يَضْرِبُونَ وُجُوهَهُمْ وَأَدْبَارَهُمْ وَذُوقُوا عَذَابَ الْحَرِيقِ ﴿٥٠﴾
ذَلِكَ بِمَا قَدَّمَتْ أَيْدِيكُمْ وَأَنَّ اللَّهَ لَيْسَ بِظَلَّامٍ لِلْعَبِيدِ ﴿٥١﴾ كَدَأْبِ آلِ فِرْعَوْنَ وَالَّذِينَ مِنْ قَبْلِهِمْ كَفَرُوا
بِآيَاتِ اللَّهِ فَأَخَذَهُمُ اللَّهُ بِذُنُوبِهِمْ إِنَّ اللَّهَ قَوِيٌّ شَدِيدُ الْعِقَابِ ﴿٥٢﴾ ذَلِكَ بِأَنَّ اللَّهَ لَمْ يَكُ مُغَيِّرًا نِعْمَةً
أَنْعَمَهَا عَلَى قَوْمٍ حَتَّى يُغَيِّرُوا مَا بِأَنْفُسِهِمْ وَأَنَّ اللَّهَ سَمِيعٌ عَلِيمٌ ﴿٥٣﴾

---

**dedilər. Amma bilmirlər ki, insan, gərək, hər bir işində Allah-Təalaya təvəkkül etməlidir, kim Allah-Təalaya təvəkkül etsə, bilsin ki, həqiqətən, Allah-Təala məxluqata qalib olub, kafir və müşriklərdən hikməti üzrə intiqam alıb, təvəkkül edən şəxsə kömək edəndir.**

**50) (وَلَوْ تَرَى إِذْ يَتَوَفَّى الَّذِينَ كَفَرُوا الْمَلَائِكَةُ)** – (ey Məhəmməd)**, mələklərin kafir olan Qüreyş camaatını öldürdüyünü bir görsəydin, (يَضْرِبُونَ وُجُوهَهُمْ وَأَدْبَارَهُمْ) – onların üzlərinə və dallarına vurub onları qətlə yetirdilər, (وَذُوقُوا عَذَابَ الْحَرِيقِ) – və onlara deyirdilər ki, dünya əzabını gördünüz, axirət əzabını da** (od əzabını) **dadın.**

**51) (ذَلِكَ بِمَا قَدَّمَتْ أَيْدِيكُمْ) – sizə olan bu əzab əllərinizlə qazanıb, qabaqcadan göndərdiyiniz o əməllərin səbəbinədir,** (yəni öz əməllərinizin səbəbinə Allah-Təala sizə axirətdə əzab edəcəkdir)**, (وَأَنَّ اللَّهَ لَيْسَ بِظَلَّامٍ لِلْعَبِيدِ) – həqiqətən, Allah-Təala heç bir şeydə bəndələrinə zülm edən deyildir. Fasiq və müşrikə əzab etmək əsl ədalətdir.**

**52) (كَدَأْبِ آلِ فِرْعَوْنَ وَالَّذِينَ مِنْ قَبْلِهِمْ) – bu Qüreyş camaatının adəti firon camaatının və onlardan əvvəl kafir olanların adəti kimidir. (كَفَرُوا بِآيَاتِ اللَّهِ) – Allah-Təalanın möcüzələrini və hökmlərini inkar etmişdilər.** (Necə ki Qüreyş də kafir oldu)**. (فَأَخَذَهُمُ اللَّهُ بِذُنُوبِهِمْ) – Allah-Təala onları öz günahlarının səbəbinə tutub əzab etdi. (إِنَّ اللَّهَ قَوِيٌّ شَدِيدُ الْعِقَابِ) – həqiqətən, Allah-Təala hər bir əməlində qüvvətlidir, heç kim ona qarşı ola bilməz. Asilərə şiddətli əzab və cəza verəndir.**

**53) (ذَلِكَ بِأَنَّ اللَّهَ لَمْ يَكُ مُغَيِّرًا نِعْمَةً أَنْعَمَهَا عَلَى قَوْمٍ حَتَّى يُغَيِّرُوا مَا بِأَنْفُسِهِمْ) – Bədir savaşında Qüreyş camaatına bu əzabın varid olmasının səbəbi odur ki, Allah-Təala bir camaata verdiyi neməti o camaat öz halını dəyişdirib, Allaha itaətdən çıxmadıqca dəyişdirməz.** (Allah-Təala Qüreyş camaatının sağ-salamat olmasını onların əsir olması və öldürülməsi ilə dəyişdirdi. Çünki Hz. Peyğəmbərin Allah-Təala tərəfindən böyük nemət olmasına şükür etməyib, ona iman gətirməyib, onu qətlə yetirmək fikrində oldular)**. (وَأَنَّ اللَّهَ سَمِيعٌ عَلِيمٌ) – həqiqətən, Allah-Təala peyğəmbəri təkzib edənlərin sözlərini eşidib onların əməllərindən agahdır.**

كَدَأْبِ آلِ فِرْعَوْنَ وَالَّذِينَ مِنْ قَبْلِهِمْ كَذَّبُوا بِآيَاتِ رَبِّهِمْ فَأَهْلَكْنَاهُمْ بِذُنُوبِهِمْ وَأَغْرَقْنَا آلَ فِرْعَوْنَ وَكُلٌّ
كَانُوا ظَالِمِينَ ﴿٥٤﴾ إِنَّ شَرَّ الدَّوَابِّ عِنْدَ اللهِ الَّذِينَ كَفَرُوا فَهُمْ لَا يُؤْمِنُونَ ﴿٥٥﴾ الَّذِينَ عَاهَدْتَ
مِنْهُمْ ثُمَّ يَنْقُضُونَ عَهْدَهُمْ فِي كُلِّ مَرَّةٍ وَهُمْ لَا يَتَّقُونَ ﴿٥٦﴾ فَإِمَّا تَثْقَفَنَّهُمْ فِي الْحَرْبِ فَشَرِّدْ بِهِمْ مَنْ
خَلْفَهُمْ لَعَلَّهُمْ يَذَّكَّرُونَ ﴿٥٧﴾ وَإِمَّا تَخَافَنَّ مِنْ قَوْمٍ خِيَانَةً فَانْبِذْ إِلَيْهِمْ عَلَى سَوَاءٍ

---

**54) (كَدَأْبِ آلِ فِرْعَوْنَ وَالَّذِينَ مِنْ قَبْلِهِمْ) – bu Qüreyş camaatının adəti firon camaatının və onlardan qabaq kafir olanların adətləri kimidir. (كَذَّبُوا بِآيَاتِ رَبِّهِمْ) – öz rəbləri Allah-Təalanın ayələrini təkzib etdilər.** (Habelə Qüreyş də Allah-Təalanın ayələrini təkzib etdi). **(فَأَهْلَكْنَاهُمْ بِذُنُوبِهِمْ) – onların hamısını öz günahları səbəbinə həlak etdik. (وَأَغْرَقْنَا آلَ فِرْعَوْنَ) – onların arasından firon camaatını dənizdə qərq etdik.** (Qüreyş camaatını da sayca az olan bir camaatın əlində həlak etdik). **(وَكُلٌّ كَانُوا ظَالِمِينَ) – əvvəllər həlak olanlar və bu Qüreyş camaatının hamısı zalım olublar. Zülmlərinin səbəbinə onları həlak etdik.**

**55) (إِنَّ شَرَّ الدَّوَابِّ عِنْدَ اللهِ) – həqiqətən, yer üzündə hərəkət edən məxluqatın ən şərlisi və ən pisi, (الَّذِينَ كَفَرُوا فَهُمْ لَا يُؤْمِنُونَ) – Allah-Təalanı inkar edən şəxslərdir, əlbəttə, onlar iman gətirməzlər.** (Bu qeyd olunan camaat Mədinə yəhudilərindən olan bəni-Qüreyzə camaatıdır. Hz. Peyğəmbərlə əhd etdilər ki, onun düşməninə kömək olmayıb, özüylə də savaşmasınlar. Bədir savaşında əhdlərini pozub, Məkkə əhlinə kömək edib, onlara silahla kömək etdilər, lakin yenə də Hz. Peyğəmbər onlarla əhd etdi. Xəndək savaşında əhdi pozub, Qüreyş camaatına qoşuldular, gələn ayədə onların əhdi pozduqlarını bəyan edir).

**56) (الَّذِينَ عَاهَدْتَ مِنْهُمْ ثُمَّ يَنْقُضُونَ عَهْدَهُمْ فِي كُلِّ مَرَّةٍ) –** (ey Məhəmməd)**, səninlə savaşmasınlar deyə onlardan əhd aldığın o camaat** (bəni-Qüreyzə)**, hər dəfə əhd edəndən sonra onu pozub, müşriklərə kömək etdilər. (وَهُمْ لَا يَتَّقُونَ) – əhdi pozmaqla dünyada ar etməkdən başqa axirətdəki od əzabından da qorxmayıb, səninlə olan əhdlərini pozdular.**

**57) (فَإِمَّا تَثْقَفَنَّهُمْ فِي الْحَرْبِ) –** (ey Məhəmməd)**, əgər bu əhdi pozan şəxsləri savaşda ələ keçirib, onlara qalib olsan, (فَشَرِّدْ بِهِمْ مَنْ خَلْفَهُمْ) – onları qətlə yetirib dağıt ki, onları qətlə yetirməklə sənə düşmən olub savaşan başqa camaatları da dağıdıb qəlblərinə qorxu salasan. Səninlə bir də savaşa bilməsinlər. (لَعَلَّهُمْ يَذَّكَّرُونَ) – bəlkə, əhdi pozan yəhudilərdən başqaları da ibrət götürüb, səninlə düşmənçilik etməkdən çəkinsinlər.**

**58) (وَإِمَّا تَخَافَنَّ مِنْ قَوْمٍ خِيَانَةً) –** (ey Məhəmməd)**, əgər səninlə əhd edən camaatdan qorxsan ki, əhdi pozub, sənə xəyanət etsinlər, (فَانْبِذْ إِلَيْهِمْ عَلَى سَوَاءٍ) – o zaman onlarla etdiyin əhdi açıq-aşkar poz. Sizinlə bağladığım əhdi pozmuşam deyə o əhdi pozduğunu onlara elan et. Ondan sonra əgər on-**

إِنَّ اللهَ لَا يُحِبُّ الْخَائِنِينَ ﴿٥٨﴾ وَلَا يَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا سَبَقُوا إِنَّهُمْ لَا يُعْجِزُونَ ﴿٥٩﴾ وَأَعِدُّوا لَهُمْ مَا اسْتَطَعْتُمْ مِنْ قُوَّةٍ وَمِنْ رِبَاطِ الْخَيْلِ تُرْهِبُونَ بِهِ عَدُوَّ اللهِ وَعَدُوَّكُمْ وَآخَرِينَ مِنْ دُونِهِمْ لَا تَعْلَمُونَهُمُ اللهُ يَعْلَمُهُمْ وَمَا تُنْفِقُوا مِنْ شَيْءٍ فِي سَبِيلِ اللهِ يُوَفَّ إِلَيْكُمْ وَأَنْتُمْ لَا تُظْلَمُونَ ﴿٦٠﴾

---

**larla savaş etmək istəsən, savaş, amma əhdi pozduğunu gizlətmə, onlar elə xəyal etməsinlər ki, sən əhdinə sadiqsən. Amma sən qəfildən onların üstünə gedib, qətl və qarət etsən, bu böyük xəyanətdir. Sənə belə şey layiq deyildir. (**إِنَّ اللهَ لَا يُحِبُّ الْخَائِنِينَ**) – həqiqətən, Allah-Təala xəyanət edən şəxsləri sevməz.**

**59) (**وَلَا يَحْسَبَنَّ الَّذِينَ كَفَرُوا سَبَقُوا**)** – (ey Məhəmməd)**, güman etmə ki, savaşdan qaçıb nicat tapan müşrikləri siz ələ keçirə bilməyəcəksiniz. Əlbəttə, onlar da yaxalanıb, əlinizdə zəlil olacaqlar. (**إِنَّهُمْ لَا يُعْجِزُونَ**) – həqiqətən, onlar sizdən xilas ola bilməz, onlara hakim olmaqdan sizi aciz edə bilməzlər.**

**60) (**وَأَعِدُّوا لَهُمْ مَا اسْتَطَعْتُمْ مِنْ قُوَّةٍ وَمِنْ رِبَاطِ الْخَيْلِ**)** – (ey müsəlmanlar)**, düşmənlərinizi dəf edib, qüvvətli olmaqdan ötrü Allah-Təala yolunda cihad üçün savaşda lazım olan silah-sursatdan və bağlanıb yetişdirilən yaxşı, gözəl atlardan* hazırlayın ki, həmişə sizdən ötrü hazır olsunlar. (**تُرْهِبُونَ بِهِ عَدُوَّ اللهِ وَعَدُوَّكُمْ**) – belə ki, o qüvvət səbəbinə Allah-Təalanın düşmənlərini və öz düşmənlərinizi qorxudasınız. (**وَآخَرِينَ مِنْ دُونِهِمْ لَا تَعْلَمُونَهُمُ اللهُ يَعْلَمُهُمْ**) - yenə qorxudasınız o düşmənlərinizi ki, onların sizə düşmən olmasından agah deyilsiniz. Onların sizə düşmən olmasından Allah-Təala agahdır. Elə ki onlara sizin qüvvət və qüdrət sahibi olmağınız məlum oldu, o vaxt sizdən qorxub, bir daha islama toxunmazlar, (**وَمَا تُنْفِقُوا مِنْ شَيْءٍ فِي سَبِيلِ اللهِ يُوَفَّ إِلَيْكُمْ**) – Allah-Təala yolunda cihad üçün nə sərf etsəniz, onun əvəzi qiyamət günündə Allah-Təaladan sizə yetişər. (**وَأَنْتُمْ لَا تُظْلَمُونَ**) – sizə heç bir zülm olunmaz, hər bir xeyir əməlinizin mükafatı tamamilə sizə yetişər.**

*(***Qeyd:** *Bu ayədə göstərilən mətləbləri şərh etməkdə nə qələmdə o imkan, nə nitqdə o bəyan, nə əldə o güc və nə də zəmanənin icazəsi var. Bir neçə kəlməylə qənaət etmək kafidir, böyük sultanlardan tutmuş ən adi şəxsə kimi, gərək, hamı bu ayəyə diqqət edib, zəmanənin şərtlərinə görə həmin ayə ilə hərəkət etsinlər. Bu nə qəflətdir ki, düçar olmuşuq. Qəflət cəhalətdir, cəhalət də elə bir xəstəlikdir ki, heç bir təbib müalicəsiylə müalicəsi mümkün deyildir. Hz. İsa bir dağa tərəf sürətlə qaçırdı, bir şəxs o həzrəti çağırıb dedi: "Ey Ruhullah, sənə bir sualım var, Allah-Təalanın rizası üçün bir qədər dayan". O cənab durdu, o şəxs sual verdi ki, ey Ruhullah, mən hərçənd sənin dalınca bir insan və ya bir heyvanın gəldiyini görmürəm, sən bu halətlə kimdən qaçırsan? Hz. İsa buyurdu ki, cahil və nadan şəxsdən qaçıram. O şəxs dedi: "Sən həmin İsasan ki, bütün xəstəlikləri müalicə edirsən, yaxşı olar ki, cahilləri də müalicə edəsən". O cənab buyurdu: "Mən hərçənd cahilləri müalicə etmək üçün səy və cəhd etdim, amma fayda vermədi, o səbəbdən də qaçmağa üstünlük verdim. (İlahi, sən özün*

وَإِنْ جَنَحُوا لِلسَّلْمِ فَاجْنَحْ لَهَا وَتَوَكَّلْ عَلَى اللهِ إِنَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ ﴿٦١﴾ وَإِنْ يُرِيدُوا أَنْ يَخْدَعُوكَ
فَإِنَّ حَسْبَكَ اللَّهُ هُوَ الَّذِي أَيَّدَكَ بِنَصْرِهِ وَبِالْمُؤْمِنِينَ ﴿٦٢﴾ وَأَلَّفَ بَيْنَ قُلُوبِهِمْ لَوْ أَنْفَقْتَ مَا فِي الْأَرْضِ
جَمِيعًا مَا أَلَّفْتَ بَيْنَ قُلُوبِهِمْ وَلَكِنَّ اللَّهَ أَلَّفَ بَيْنَهُمْ إِنَّهُ عَزِيزٌ حَكِيمٌ ﴿٦٣﴾ يَا أَيُّهَا النَّبِيُّ

---

*bu cəhalətimizi müalicə et ki, Hz. Peyğəmbərin gözəl şəriətini və islamın gözəl qanunlarını ayaqlar altına salmayaq. Ayəni çox şərh etdiyim üçün məni üzürlü hesab edin).*

**61) (وَإِنْ جَنَحُوا لِلسَّلْمِ فَاجْنَحْ لَهَا)** – (ey Məhəmməd)**, əgər müşriklər səninlə savaşmağı tərk edib sülhə meyil etsələr, sən də barışığa meyil edib onlarla sülh bağla. (وَتَوَكَّلْ عَلَى اللهِ) – sülhdə Allah-Təalaya təvəkkül edib, onların gizlində bir məkr və hiylə etməsindən qorxma, Allah-Təala onların məkr və hiyləsini batil edib, sənə nicat verəndir. (إِنَّهُ هُوَ السَّمِيعُ الْعَلِيمُ) – həqiqətən, Allah-Təala müşriklərin sözlərini eşidir, məkr və hiylələrindən agahdır.**

**62) (وَإِنْ يُرِيدُوا أَنْ يَخْدَعُوكَ)** – (ey Məhəmməd)**, əgər müşriklər səndən ötrü məkr və hiylə etmək istəsələr, onlardan qorxma, (فَإِنَّ حَسْبَكَ اللَّهُ) – həqiqətən, sənə kömək olub mühafizə edən Allah-Təala sənə kifayət edər. (هُوَ الَّذِي أَيَّدَكَ بِنَصْرِهِ وَبِالْمُؤْمِنِينَ)** – (ey Məhəmməd)**, o, Allah-Təaladır ki, özünün, bir də möminlərin** (ənsarın) **köməyi ilə sənə qüvvət verdi,**

**63) (وَأَلَّفَ بَيْنَ قُلُوبِهِمْ) – möminlər cahiliyyə zamanında bir-biriləri ilə düşmən olandan sonra onların qəlblərini iman səbəbinə dostluqla birləşdirdi. (لَوْ أَنْفَقْتَ مَا فِي الْأَرْضِ جَمِيعًا مَا أَلَّفْتَ بَيْنَ قُلُوبِهِمْ)** – (ey Məhəmməd)**, əgər sən onların qəlblərini birləşdirib, bir-biriləri ilə dost etmək üçün yer üzündə olan bütün şeyləri xərcləsəydin də, hər halda səndə o qüdrət olmaz idi. Bu işlərdə qüdrət sahibi Allah-Təaladır. (وَلَكِنَّ اللَّهَ أَلَّفَ بَيْنَهُمْ) – lakin Allah-Təala möminlərin arasına dostluq, birlik saldı, Allah-Təaladan başqa heç bir şəxs buna qadir deyildi. (إِنَّهُ عَزِيزٌ حَكِيمٌ) – həqiqətən, Allah-Təala məxluqata qalibdir. Hikmət üzrə onları bir-birilərinə dost edər.** (Mədinə əhli Hz. Peyğəmbərdən əvvəl bir-biriləri ilə həmişə münaqişə içində idilər, Mədinə əhli 2 böyük qəbiləyə, Evs və Xəzrəc qəbilələrinə bölünmüşdü. Bir-biriləri ilə həmişə münaqişə edib, savaşardılar. Hz. Peyğəmbər Mədinəyə gələndən sonra elə ki Mədinə əhli imana gəldi, Allah-Təala onları Hz. Peyğəmbərin sayəsində bir-birilərinə dost etdi. Cahiliyyə dövründə aralarında olan ədavət birdəfəlik götürülüb, Allah-Təala onları ənsar – islamın köməkçisi adlandırdı. Onların bir-biriləri ilə ülfət bağlayıb, dost olmaları islamın haqq din olmasına böyük, açıq-aşkar bir dəlildir).

**64) (يَا أَيُّهَا النَّبِيُّ)** – (Ey nəbi)**, ey peyğəmbər,** (Allah-Təala Qurani-Şərifdə hər dəfə peyğəmbərə xitab edəndə bu şəkildə xitab edibdir, ya da – ey rəsul buyurubdur. Heç vaxt - "ey Məhəmməd," şəklində ona xitab etməyibdir ki, möminlər də bundan ibrət alıb Hz. Peyğəmbəri öz adıyla çağırmasınlar və bu

**حَسْبُكَ اللّٰهُ وَمَنِ اتَّبَعَكَ مِنَ الْمُؤْمِنِينَ ﴿٦٤﴾ يَا أَيُّهَا النَّبِيُّ حَرِّضِ الْمُؤْمِنِينَ عَلَى الْقِتَالِ إِنْ يَكُنْ مِنْكُمْ عِشْرُونَ صَابِرُونَ يَغْلِبُوا مِائَتَيْنِ وَإِنْ يَكُنْ مِنْكُمْ مِئَةٌ يَغْلِبُوا أَلْفًا مِنَ الَّذِينَ كَفَرُوا بِأَنَّهُمْ قَوْمٌ لَا يَفْقَهُونَ ﴿٦٥﴾ الْآنَ خَفَّفَ اللّٰهُ عَنْكُمْ وَعَلِمَ أَنَّ فِيكُمْ ضَعْفًا فَإِنْ يَكُنْ مِنْكُمْ مِئَةٌ صَابِرَةٌ يَغْلِبُوا مِائَتَيْنِ وَإِنْ يَكُنْ مِنْكُمْ أَلْفٌ يَغْلِبُوا أَلْفَيْنِ بِإِذْنِ اللّٰهِ وَاللّٰهُ مَعَ الصَّابِرِينَ ﴿٦٦﴾**

---

səbəbdən də möminlər o həzrəti çağıranda - ey rəsulullah deyirdilər. Amma bəzi ayələrin təfsirlərində bizim (ey Məhəmməd) şəklində yazmağımız ayənin batinində olan nidanı izhar etmək üçündür). (حَسْبُكَ اللّٰهُ وَمَنِ اتَّبَعَكَ مِنَ الْمُؤْمِنِينَ) - **sənə kömək etməkdə Allah-Təala və bir də sənə tabe olub iman gətirən möminlər kifayət edər. Allah-Təala səni düşmənə qalib edəcəkdir,** (Necə ki Bədirdə qalib etdi)**.**

**65) (يَا أَيُّهَا النَّبِيُّ حَرِّضِ الْمُؤْمِنِينَ عَلَى الْقِتَالِ) – ey peyğəmbər, yaxşı, gözəl sözlərlə möminləri cihad etməyə vadar et ki, Allah-Təala yolunda cihad etsinlər, (إِنْ يَكُنْ مِنْكُمْ عِشْرُونَ صَابِرُونَ يَغْلِبُوا مِائَتَيْنِ) – əgər siz möminlərdən cihadda 20 nəfər səbir edən şəxs olsa, 200 nəfər kafirlərin müqabilində durub onlara qalib olarsınız, sizdən 20 nəfərin 100 nəfər müşrikin müqabilində durması sizə vacibdir. (وَإِنْ يَكُنْ مِنْكُمْ مِئَةٌ يَغْلِبُوا أَلْفًا مِنَ الَّذِينَ كَفَرُوا) – əgər sizdən cihadda 100 nəfər səbir edən şəxs olsa, 1000 nəfər kafirin müqabilində durub onlara qalib olarsınız. (بِأَنَّهُمْ قَوْمٌ لَا يَفْقَهُونَ) – sizin onlara qalib olmağınız müşriklərin idraksız və cahil olan bir camaat olması səbəbilədir, siz isə din yolunda bəsirət üzrə savaşırsınız. Amma onlar cəhalət və nadanlıqları səbəbi ilə savaşdıqları üçün, əlbəttə, siz onlara qalib olarsınız,** (elə ki bu ayə nazil oldu, möminlərə bu təklif ağır gəlib düşünməyə başladılar ki, 10 nəfərə müqabil 1 nəfər necə savaşacaqlar? Ondan sonra bu ayə nazil oldu (Əbu Davud, Cihad 106))**.**

**66) (الْآنَ خَفَّفَ اللّٰهُ عَنْكُمْ)** – (ey möminlər)**, indi ki bu təklif sizə ağır gəldi, Allah-Təala sizə yüngüllük verib o təklifi sizdən götürdü. (وَعَلِمَ أَنَّ فِيكُمْ ضَعْفًا) – Allah-Təala imtahan məqsədilə sizə bu təklifi vermişdi, yoxsa Allah-Təala özü agah idi ki, 10 nəfərə müqabil bir nəfər durmaqda sizdə zəiflik vardır. Ona görə sizə yüngüllük verdi. (فَإِنْ يَكُنْ مِنْكُمْ مِئَةٌ صَابِرَةٌ يَغْلِبُوا مِائَتَيْنِ) – əgər sizdən cihadda 100 nəfər səbir edən şəxs olsa, 200 nəfər kafirin müqabilində durub onlara qalib olarsınız. İki nəfərə müqabil bir nəfər durmanızı Allah-Təala sizə vacib etdi. (وَإِنْ يَكُنْ مِنْكُمْ أَلْفٌ يَغْلِبُوا أَلْفَيْنِ بِإِذْنِ اللّٰهِ) – əgər sizdən cihadda min nəfər səbir edən şəxs olsa, iki min nəfərin müqabilində durub onlara qalib olarsınız. (وَاللّٰهُ مَعَ الصَّابِرِينَ) – Allah-Təala səbir edənlərlə birlikdədir və onlara kömək edəndir.** (Bədir savaşında müsəlmanlar müşriklərdən 70 nəfəri qətlə yetirdilər və 70 nəfəri də əsir aldılar. O əsirlərin arasında peyğəmbərin əmisi Abbas və Əbu Talibin oğlu Aqil də var idi. Hz. Peyğəmbər səhabələrlə əsirlərin haqqında məşvərət etdi. Bu-

مَا كَانَ لِنَبِيٍّ أَنْ يَكُونَ لَهُ أَسْرَى حَتَّى يُثْخِنَ فِي الْأَرْضِ تُرِيدُونَ عَرَضَ الدُّنْيَا وَاللَّهُ يُرِيدُ الْآخِرَةَ وَاللَّهُ عَزِيزٌ حَكِيمٌ ﴿٦٧﴾ لَوْلَا كِتَابٌ مِنَ اللَّهِ سَبَقَ

---

yurdu ki, bu barədə rəyinizi bildirin, bəs bu əsirləri qətlə yetirək, yoxsa onlardan fidyə alıb azad edək? Əbu Bəkir dedi: “Ey Peyğəmbər, bunlar sənin qövmün və camaatındır, bunları qətlə yetirmə ki, bəlkə, tövbə edib islama daxil olsunlar. Onlardan fidyə alıb azad et. Həm onlar azad olsunlar, həm də müsəlmanların dünya malı artsın”. Ənsardan Evs qəbiləsinin ağası Sə`d ibn Muaz dedi ki, “Ey Peyğəmbər, bu islamda ilk savaşdır, mənə görə müşriklərin qəlbinə qorxu salmaq üçün bunları qətlə yetirmək fidyə almaqdan daha yaxşıdır belə ki, bir daha müsəlmanlara qarşı çıxmağa cəsarət etməsinlər”. Abdullah ibn Rəvaha (mühacirlərdən) dedi: “Ey Peyğəmbər, bu çölə bax, hansı yer daha çox ağaclıqdırsa, bu əsirləri oraya daxil edib, ondan sonra oraya od vurub onları tamamən yandır”. Abbas orada idi. Dedi: “Pis söz dedin və qohumluq bağını kəsdin”. Ömər dedi: “Ey Peyğəmbər, bunlar səni təkzib edib Məkkədən çıxmana bais oldular, hökm ver bunların hamısını qətlə yetirək. Bu əsir olanlar kafirlərin rəisləridirlər. Hökm ver, Əli Aqili qətlə yetirsin, Həmzə Abbası və mən də öz qohumumu qətlə yetirim”. Hz. Peyğəmbər heç kimin fikrini qəbul etməyib, ancaq Əbu Bəkirin rəyinə üstünlük verib buyurdu: “Bunlar qətl edilməyib, fidyələri alınsın”. Əsirlərdən fidyə alıb buraxdılar. Hər bir əsirdən 40 oqqa* qızıl aldılar. Allah-Təala Hz. Peyğəmbərin və onunla birlikdə fidyəyə razı olanların hərəkətini bəyənmədi. O 70 nəfər ki, fidyə alıb buraxmışdılar, onların əvəzinə Uhud savaşında müsəlmanlardan 70 nəfər qətl edildi. Allah-Təala sıradakı ayədə belə buyurur:)

*(***Qeyd:** Hər oqqa – oqiyyə 7 misqal yarımdır, 1 misqal 4, 65 qr-dır).*

**67) (مَا كَانَ لِنَبِيٍّ أَنْ يَكُونَ لَهُ أَسْرَى حَتَّى يُثْخِنَ فِي الْأَرْضِ) – heç bir peyğəmbərə caiz deyil ki, düşmənə qalib olub, əsir edəndən sonra yer üzündə onlardan bir çoxunu qətlə yetirib, zəlil və məğlub etməyin əvəzinə fidyə alıb azad etsin.** (Yəni ey Məhəmməd, bu islamda ilk savaşdır, fidyə verənlərin əksəriyyəti də islama daxil olan deyildi. Gərək, fidyəni tərk edib, onları qətlə yetirəydiniz ki, islamın şan-şövkəti də artaydı. Necə ki Sə`d ibn Muaz və Ömər ibn Xəttab demişdi). **(تُرِيدُونَ عَرَضَ الدُّنْيَا وَاللَّهُ يُرِيدُ الْآخِرَةَ) – siz dünya malını istəyib, dünya malından ötrü müşrikləri buraxırsınız. Amma Allah-Təala axirəti istəyir. Aldığınız dünya malından sizə bir fayda olmaz. (وَاللَّهُ عَزِيزٌ حَكِيمٌ) – Allah-Təala məxluqata qalib olub dostunu düşməninə qalib edər və etdiyi hər bir işi də hikmət üzrə edər.**

**68) (لَوْلَا كِتَابٌ مِنَ اللَّهِ سَبَقَ) – əgər Allah-Təalanın ictihadında xəta edən şəxsə əzab etməyəcəyi haqqında daha əvvəl verdiyi hökmü olmasaydı,** (Necə ki siz bu işdə ictihad edib fidyə almağa üstünlük verdiniz, amma bu

لَمَسَّكُمْ فِيمَا أَخَذْتُمْ عَذَابٌ عَظِيمٌ ﴿٦٨﴾ فَكُلُوا مِمَّا غَنِمْتُمْ حَلاَلًا طَيِّبًا وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ غَفُورٌ
رَحِيمٌ ﴿٦٩﴾ يَا أَيُّهَا النَّبِيُّ قُلْ لِمَنْ فِي أَيْدِيكُمْ مِنَ الْأَسْرَى إِنْ يَعْلَمِ اللَّهُ فِي قُلُوبِكُمْ خَيْرًا يُؤْتِكُمْ
خَيْرًا مِمَّا أُخِذَ مِنْكُمْ وَيَغْفِرْ لَكُمْ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿٧٠﴾

---

ictihadınızda xəta etdiniz). **(لَمَسَّكُمْ فِيمَا أَخَذْتُمْ عَذَابٌ عَظِيمٌ) - əgər Allah-Təalanın o əvvəlki hökmü olmasaydı, hər halda fidyə aldığınıza görə sizə böyük əzab yetişərdi.** (elə ki bu ayə nazil oldu, bütün müsəlmanlar aldıqları qənimətdən və fidyədən əl çəkib, onu xərcləməkdən qorxdular. Ondan sonra sıradakı ayə nazil oldu).

**69) (فَكُلُوا مِمَّا غَنِمْتُمْ حَلاَلًا طَيِّبًا)** – (ey möminlər)**, gərək, fidyə almayaydınız, indi ki alıbsınız, aldığınız qənimət və fidyəni halal, pak olaraq yeyin.** (وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ) – **Allah-Təaladan qorxub bundan sonra izinsiz heç bir əmələ başlamayın. Bu əməlinizi Allah-Təala sizə bağışladı. Həqiqətən, Allah-Təala tövbə edənləri bağışlayıb rəhm edəndir.**

**70) (يَا أَيُّهَا النَّبِيُّ) – ey peyğəmbər, (قُلْ لِمَنْ فِي أَيْدِيكُمْ مِنَ الْأَسْرَى) – əlinizdə olan əsirlərə de ki,** (o vaxt hələ onları azad etməmişdilər)**, (إِنْ يَعْلَمِ اللَّهُ فِي قُلُوبِكُمْ خَيْرًا) – əgər Allah-Təala sizin qəlbinizdə olan pak niyyətdən və ixlaslı imandan agah olsa, (yəni əgər siz imana daxil olub qəlbinizi şirkdən pak etsəniz. Onların imansızlığının dəlili Allah-Təalanın bundan agah olmamasıdır). (يُؤْتِكُمْ خَيْرًا مِمَّا أُخِذَ مِنْكُمْ) – Allah-Təala sizdən alınan fidyədən daha yaxşısını həm dünyada, həm də axirətdə sizə bəxş edər, (وَيَغْفِرْ لَكُمْ) – keçmiş günahlarınızı da bağışlayar. (وَاللَّهُ غَفُورٌ رَحِيمٌ) – şirkdən dönüb, imana daxil olan şəxsləri Allah-Təala bağışlayıb rəhm edəndir.** (Hz. Peyğəmbərin əmisi Abbası fidyədən ötrü onun hüzuruna gətirdilər, Abbas dedi ki, ya peyğəmbər, mən müsəlmanam, zorla savaşa gətirdilər. Hz. Peyğəmbər buyurdu ki, əgər bu sözün doğru isə, Allah-Təala sənə mükafat verər, amma zahirdə bizə zərər yetirib, bizə qarşı çıxıbsan. Müşriklər Bədirdə olan zamanda onların arasında bir neçə nəfər var idi ki, gündə onlardan bir nəfər müşrik ordusuna yemək verərdi. Onlardan biri də Abbas idi). Hz. Peyğəmbər buyurdu: "Ey əmi, gərək, özündən ötrü, qardaşın oğlundan (Aqil) ötrü, bir də o biri qardaşından (Nofəl ibn Haris) ötrü fidyə verəsən. Bu iki nəfərin fidyəsini, gərək, sən verəsən, çünki onlarda bir şey yoxdur". Abbas dedi: "Ey Məhəmməd, istəyirsən mən kasıb olum? Qüreyşdən soruşun, mənim heç bir dünya malım yoxdur". Buyurdu ki, necə oldu o qızıllar? Bədirə gələndə xanımın Ümmül-Fazilə verib belə demişdin: "Bilmirəm mənim bu getməyimin axırı nə olacaq? Əgər öldürülsəm, bu qızıllar sənin və oğullarımındır". (Abbasın xanımı Ümmül-Fazilə, bir də qulamı Əbu Rafi Hz. Peyğəmbər hələ Məkkədə olanda imana gəlmişdilər). Abbas dedi: "Mən şəhadət edirəm ki, doğru deyirsən, Allah-Təala vahid və şəriksizdir. Sən də onun peyğəmbərisən. Gecənin qaranlığında, sadəcə ikimiz orda olduğumuz zaman o qızılları mən Ümmül-Faziləyə vermişəm. Mən sənə

وَإِنْ يُرِيدُوا خِيَانَتَكَ فَقَدْ خَانُوا اللَّهَ مِنْ قَبْلُ فَأَمْكَنَ مِنْهُمْ وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿٧١﴾ إِنَّ الَّذِينَ آمَنُوا
وَهَاجَرُوا وَجَاهَدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ فِي سَبِيلِ اللَّهِ وَالَّذِينَ آوَوْا وَنَصَرُوا أُولَئِكَ بَعْضُهُمْ أَوْلِيَاءُ
بَعْضٍ وَالَّذِينَ آمَنُوا وَلَمْ يُهَاجِرُوا مَا لَكُمْ مِنْ وَلَايَتِهِمْ مِنْ شَيْءٍ حَتَّى يُهَاجِرُوا وَإِنِ اسْتَنْصَرُوكُمْ
فِي الدِّينِ فَعَلَيْكُمُ النَّصْرُ إِلَّا عَلَى قَوْمٍ بَيْنَكُمْ وَبَيْنَهُمْ مِيثَاقٌ وَاللَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ ﴿٧٢﴾

---

şübhə edirdim. Amma indi şübhədən xilas oldum". Abbas 3 nəfərin fidyəsini verib imana daxil oldu. Ondan sonra Allah-Təala onu var-dövlət sahibi etdi).

**71) (**وَإِنْ يُرِيدُوا خِيَانَتَكَ**)** – (ey Məhəmməd)**, əgər bu müşriklərdən əsir olub sonra müsəlman olanların fikirləri sənə xəyanət etmək olsa, (**فَقَدْ خَانُوا اللَّهَ مِنْ قَبْلُ**) – həqiqətən, onlar bundan əvvəl də Allah-Təalaya xəyanət edib müşrik olmuşdular. (**فَأَمْكَنَ مِنْهُمْ**) – Allah-Təala onlara hakim olub, onları zəlil etdi. Bundan sonra da onlara hakim olacaqsan, onlardan qorxma. (**وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ**) – Allah-Təala onların batinlərinə agahdır, hikmət üzrə onları zəlil edəndir.**

**72) (**إِنَّ الَّذِينَ آمَنُوا وَهَاجَرُوا**) – həqiqətən, iman gətirib** (Məkkədən Mədinəyə hicrət edib)**, mallarından keçən o şəxslər (**وَجَاهَدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ فِي سَبِيلِ اللَّهِ**)** – **malları və canlarıyla Allah-Təala yolunda cihad etdilər, (**وَالَّذِينَ آوَوْا وَنَصَرُوا**)** – **və bu hicrət edənlərə mənzil verib kömək edən o şəxslər** (Mədinə əhli olan ənsar), **(**أُولَئِكَ بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ**)** – (bu qeyd olunanlar mühacirlər və ənsardır)**, əlbəttə gərək bir-birilərinə dost olub, kömək etsinlər. Yaxın qohum da olsa, kafirləri, gərək, tərk etsinlər. (**وَالَّذِينَ آمَنُوا وَلَمْ يُهَاجِرُوا**) – amma iman gətirib hicrət etməyən şəxslərə gəldikdə, (**مَا لَكُمْ مِنْ وَلَايَتِهِمْ مِنْ شَيْءٍ حَتَّى يُهَاجِرُوا**) – siz müsəlmanlardan ötrü onlar sizin tərəfə hicrət edənə qədər onları dost tutub məhəbbət bəsləmək olmaz.** (İmanın böyük şərti küfr yurdundan iman yurduna hicrət etməkdir, iman etdiyi halda, küfr yurdunda qalan müsəlmanların imanı naqisdir). **(**وَإِنِ اسْتَنْصَرُوكُمْ فِي الدِّينِ فَعَلَيْكُمُ النَّصْرُ**) – lakin iman gətirib hicrət etməyənlər** (kafirlərdən onların dininə zərər gəldiyində) **əgər sizdən din barəsində kömək istəsələr, belə vaxtda onlara kömək etmək sizə lazımdır. (**إِلَّا عَلَى قَوْمٍ بَيْنَكُمْ وَبَيْنَهُمْ مِيثَاقٌ**) – ancaq sizdən möminlərlə aralarında əhd olan bir camaatın** (əhli-kitabın) **zərərinə sizdən kömək istəsələr, o vaxt onlara kömək* etmək lazım deyil, çünki əhd edən əhli-kitabın ehtiramı hicrət etməyən möminlərdən artıqdır. (**وَاللَّهُ بِمَا تَعْمَلُونَ بَصِيرٌ**) – Allah-Təala etdiyiniz əməllərin hamısını görəndir. Elə olmasın ki, hicrət etməyən möminlərdən ötrü əhd etdiyiniz əhli-kitaba əziyyət edəsiniz.**

*(*****Qeyd:** İslamın ilk dövrlərində xalqı zorla imana daxil ediblər deyən şəxslər bu mövzuda islama tənə edib böyük irad tuturlar. Amma o şəxslər bu ayəyə diqqət edib, fikir versinlər ki, o, insaf və insaniyyətin əsasıdır. Baxıb görsünlər ki, şəriət sahibi əhli-kitabı nə qədər mühafizə edib , hətta onları öz həmdinlərindən üstün tutubdur. Necə ki ayədə qeyd olundu. Əhli-kitab şəriət sahibindən heç bir əziyyətə düçar olmayıb, ancaq nə vaxt ki, özləri əhdi pozub, xəyanət ediblər, o, istisnadır. Necə ki Qüreyzə*

وَالَّذِينَ كَفَرُوا بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ إِلَّا تَفْعَلُوهُ تَكُنْ فِتْنَةٌ فِي الْأَرْضِ وَفَسَادٌ كَبِيرٌ ﴿٧٣﴾ وَالَّذِينَ آمَنُوا
وَهَاجَرُوا وَجَاهَدُوا فِي سَبِيلِ اللَّهِ وَالَّذِينَ آوَوْا وَنَصَرُوا أُولَئِكَ هُمُ الْمُؤْمِنُونَ حَقًّا لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ
كَرِيمٌ ﴿٧٤﴾ وَالَّذِينَ آمَنُوا مِنْ بَعْدُ وَهَاجَرُوا وَجَاهَدُوا مَعَكُمْ فَأُولَئِكَ مِنْكُمْ وَأُولُو الْأَرْحَامِ بَعْضُهُمْ
أَوْلَى بِبَعْضٍ فِي كِتَابِ اللَّهِ إِنَّ اللَّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿٧٥﴾

---

*və bəni-Nəzir yəhudiləri əhdlərini pozub, gedib Məkkə əhlini Hz. Peyğəmbərlə savaşmağa vadar etdilər. Belə olan halda şəriət sahibinə nə irad tutula bilər?)*

**73)** (وَالَّذِينَ كَفَرُوا بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ) – **küfrlərində möhkəm olan şəxslər bir-birilərini dost tutub kömək olanlardır, siz möminlər onlara dost deyilsiniz.** (إِلَّا تَفْعَلُوهُ تَكُنْ فِتْنَةٌ فِي الْأَرْضِ وَفَسَادٌ كَبِيرٌ) – **əgər siz möminlər əmr etdiyim hökmlərə əməl etməyib, itaətdən çıxsanız, hər halda yer üzündə fitnə və böyük fəsad zahir olar.** (Müşriklər siz müsəlmanları məkr və hiylə ilə özlərinə dost edib, ondan sonra məkr və hiylələrini qəfildən aşkar edib sizi bəlaya salırlar. Elə ki siz müsəlmanlar birləşib, bir əl kimi oldunuz, heç bir nəfər sizə əziyyət etməyə qadir olmaz. Bütün düşmənlərinizə qalib olarsınız).

**74)** (وَالَّذِينَ آمَنُوا وَهَاجَرُوا وَجَاهَدُوا فِي سَبِيلِ اللَّهِ) – **o şəxslər ki iman gətirib, hicrət edib Allah-Təala yolunda cihad etdilər,** (وَالَّذِينَ آوَوْا وَنَصَرُوا) – **və o şəxslər** (ənsar) **ki, mühacirlərə mənzil verib kömək etdilər,** (أُولَئِكَ هُمُ الْمُؤْمِنُونَ حَقًّا) – **əlbəttə, haqq olan iman əhli bu mühacirlər və ənsardır,** (لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ) – **onlardan ötrü Allah-Təala yanında Allah-Təalanın bağışlaması və yaxşı, gözəl olan ruzilər vardır.**

**75)** (وَالَّذِينَ آمَنُوا مِنْ بَعْدُ) – **o şəxslər ki siz ilk mühacirlər iman gətirəndən sonra iman gətirdilər,** (وَهَاجَرُوا وَجَاهَدُوا مَعَكُمْ) – **və sizdən sonra hicrət edib sizinlə birlikdə Allah-Təala yolunda cihad etdilər,** (فَأُولَئِكَ مِنْكُمْ) – **o möminlər də sizdəndirlər. Onların xeyri sizin xeyrinizdir. Onların zərəri sizin zərərinizdir.** (وَأُولُو الْأَرْحَامِ بَعْضُهُمْ أَوْلَى بِبَعْضٍ فِي كِتَابِ اللَّهِ) – **hərçənd siz möminlər bir can kimisiniz, amma elə xəyal edilməsin ki, ölüm vaxtı bir-birinizdən miras götürə bilərsiniz. Bəlkə, mirasda Allah-Təalanın hökmü budur ki, aralarında soy bağı olan qohumlar bir-birilərindən miras almaqda digərlərindən üstün və öncədirlər, soyda da öndə olanlar ikinci dərəcədə olanların miras almasına manedirlər).** (إِنَّ اللَّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) – **həqiqətən, Allah-Təala hər bir şeydən agahdır.**

Allaha həmd olsun, Ənfal surəsi tamamlandı. Cihad etmək, müttəfiq və birlik içində olmaq haqqındadır. Bu surədə nazil olan ayələrə ağıl sahiblərinin diqqət etməsi lazımdır. Hz. Peyğəmbər buyurubdur: "Kim Ənfal surəsini oxuyub, onun mənasını təfəkkür etsə, mən ondan ötrü qiyamət günündə şəfaət edərəm".

## ət-TÖVBƏ SURƏSİ

9-cu surədir. Mədinədə nazil olub, 129 ayə, 2078 kəlmə və 12088 hərfdir.

**Əuzu billahi minəş-şeytanir-rəcim**

**Bu surədə islam dininə zərər vurub, müsəlmanlara əziyyət edən müşriklərin qətlinə hökm verildiyi üçün surənin əvvəlində gələn və rəhmət ayəsi olan "bismillahir-rəhmanir-rəhim" tərk edilmişdir.**

**Məkkə hicrətin 8-ci ilində müzəffər islam ordusu tərəfindən fəth edildi. Bu mübarək surə isə hicrətin 9-cu ilində nazil olubdur. Bu surə nazil olana qədər müşriklər Məkkədə sakin olub öz dinlərinə görə Kəbəni tavaf edirdilər. Müsəlmanlar müşriklərlə əhd etmişdilər ki, müşriklər itaət etsələr, aralarında savaş olmayacaq. Müşriklər əhdi pozub, itaətdən çıxdılar. O zaman bu surə nazil oldu. Hz. Peyğəmbər bu surədən 40 ayə Əbu Bəkirə verib, özünü də həcc əmiri təyin edib Məkkəyə göndərdi ki, o ayələrin hökmlərini Məkkə əhlinə elan etsin. Ondan sonra Hz. Əlini onun arxasından göndərdi. Ona ayələri Əbu Bəkirdən alıb xalqa bildirməyi əmr etdi. Səbəbini soruşdular. Buyurdu ki, Allah-Təala tərəfindən vəzifələndirilmişəm, bu ayələri ya mən onlara bildirməliyəm, ya da məndən olan bir adam. Hz. Əli Hz. Peyğəmbərin Əzba adlanan dəvəsinə minib yola düşdü. Əbu Bəkir və onun yoldaşları yolda qəfildən Hz. Peyğəmbərin dəvəsinin səsini eşitdiklərində, donub qaldılar. Bir də gördülər ki, Hz. Əli gəldi. O, gəlib Hz. Peyğəmbərin hökmünü yetirdi. Əbu Bəkir itaət edib ayələri təslim etdi. Özü Mədinəyə qayıdıb peyğəmbərdən soruşdu: "Mənim haqqımda Allah-Təaladan bir şey nazil olubdurmu?" Hz. Peyğəmbər buyurdu ki, "Heç bir şey nazil olmayıbdır. Sən gedib öz əməlinə - həcc əmirliyinə davam et, amma ayələri, gərək Əli təbliğ etsin". Əbu Bəkir qayıdıb Məkkəyə getdi. Ərəfatda, Minada Hz. Əli o 40 ayəni xalqa bildirdi. Əbu Bəkir də ona kömək etdi. Ondan sonra Hz. Əli dedi: "Ey insanlar, Hz. Peyğəmbər tərəfindən bu dörd əmri sizə bildirməklə vəzifələndirilmişəm: 1- bu ildən sonra heç bir müşrikə Allah-Təalanın evi olan Kəbəyə gəlib tavaf etməsinə izin yoxdur. 2- tavaf edilən zaman lüt-üryan tavaf edilməsin,** (ərəblərdən hər hansı bir kişi, ya da qadın libasla tavaf etsəydi, gərək, o libası sədəqə verəydilər, o səbəbdən lüt- üryan tavaf edərdilər). **3- hər bir müşrik Hz. Peyğəmbərlə olan əhdinin son gününə qədər ona sadiq qalacaq. 4- Allah-Təalaya və Qurana iman gətirən şəxsdən başqası cənnətə daxil olmayacaq".** (Bundan sonra bu mübarək surənin təfsiri başlayır)**.**

بَرَاءَةٌ مِنَ اللَّهِ وَرَسُولِهِ إِلَى الَّذِينَ عَاهَدْتُمْ مِنَ الْمُشْرِكِينَ ﴿١﴾ فَسِيحُوا فِي الْأَرْضِ أَرْبَعَةَ أَشْهُرٍ
وَاعْلَمُوا أَنَّكُمْ غَيْرُ مُعْجِزِي اللَّهِ وَأَنَّ اللَّهَ مُخْزِي الْكَافِرِينَ ﴿٢﴾ وَأَذَانٌ مِنَ اللَّهِ وَرَسُولِهِ إِلَى النَّاسِ
يَوْمَ الْحَجِّ الْأَكْبَرِ أَنَّ اللَّهَ بَرِيءٌ مِنَ الْمُشْرِكِينَ وَرَسُولُهُ فَإِنْ تُبْتُمْ فَهُوَ خَيْرٌ لَكُمْ وَإِنْ تَوَلَّيْتُمْ فَاعْلَمُوا
أَنَّكُمْ غَيْرُ مُعْجِزِي اللَّهِ وَبَشِّرِ الَّذِينَ كَفَرُوا بِعَذَابٍ أَلِيمٍ ﴿٣﴾ إِلَّا الَّذِينَ عَاهَدْتُمْ مِنَ الْمُشْرِكِينَ ثُمَّ
لَمْ يَنْقُصُوكُمْ شَيْئًا وَلَمْ يُظَاهِرُوا عَلَيْكُمْ أَحَدًا

---

**1)** (بَرَاءَةٌ مِنَ اللَّهِ وَرَسُولِهِ إِلَى الَّذِينَ عَاهَدْتُمْ مِنَ الْمُشْرِكِينَ) – **Allah-Təala və onun peyğəmbərinin** (Hz. Məhəmmədin) **hökmü siz müsəlmanlarla əhd edən müşriklərə yetişib onlara məlum olsun ki, Allah-Təala və onun peyğəmbəri onlardan bezmişdir. Sizinlə onların arasında bundan sonra əhd və anlaşma yoxdur, o səbəbə görə ki, onlar əhdi pozublar.**

**2)** (فَسِيحُوا فِي الْأَرْضِ أَرْبَعَةَ أَشْهُرٍ) – (ey Məhəmməd), **müşriklərə de ki, ey müşriklər, Məkkədə əmin-amanlıq içində 4 ay gəzib dolanın. 4 aydan sonra sizdən bir nəfər də Məkkədə qala bilməz, gərək, oradan gedəsiniz, çünki xəyanətkar olub itaətdən çıxdınız.** (وَاعْلَمُوا أَنَّكُمْ غَيْرُ مُعْجِزِي اللَّهِ) – (ey müşriklər), **bilin ki, siz Allah-Təaladan qaçıb, Allah-Təalanı aciz edə bilməzsiniz. Hərçənd Allah-Təalanın itaətindən çıxdınız, amma nə vaxt olsa Allah-Təala sizə hakim olub intiqam alacaqdır.** (وَأَنَّ اللَّهَ مُخْزِي الْكَافِرِينَ) – **həqiqətən, Allah-Təala kafirləri dünyada qətl edilməklə və axirətdə cəhənnəm odunun əzabıyla zəlil edəndir.**

**3)** (وَأَذَانٌ مِنَ اللَّهِ وَرَسُولِهِ إِلَى النَّاسِ يَوْمَ الْحَجِّ الْأَكْبَرِ) – **Allah-Təala və onun peyğəmbəri** (Hz. Məhəmməd) **tərəfindən böyük həcc** (Ərəfə) **günündə Ərəfat çölündə olan xalqa bir bildiriş:** (أَنَّ اللَّهَ بَرِيءٌ مِنَ الْمُشْرِكِينَ وَرَسُولُهُ) – **həqiqətən, Allah-Təala və onun peyğəmbəri** (Hz. Məhəmməd) **müşriklərdən uzaq və bezardırlar, bundan sonra onlardan ötrü əhd yoxdur. Çünki onlar əhdi pozan xəyanətkar bir camaatdırlar.** (فَإِنْ تُبْتُمْ فَهُوَ خَيْرٌ لَكُمْ) – **ey müşriklər, əgər şirkdən tövbə edib imana daxil olsanız, o sizdən ötrü yaxşıdır, o vaxt dünya və axirətdə salamat olarsınız.** (وَإِنْ تَوَلَّيْتُمْ) – **əgər tövbə etməkdən üz döndərsəniz,** (فَاعْلَمُوا أَنَّكُمْ غَيْرُ مُعْجِزِي اللَّهِ) – **bilin ki, həqiqətən, siz Allah-Təaladan qaçıb, onu aciz edən deyilsiniz. Əlbəttə, Allah-Təala sizə hakim olub intiqam alandır.** (وَبَشِّرِ الَّذِينَ كَفَرُوا بِعَذَابٍ أَلِيمٍ) – (ey Məhəmməd), **kafir olan şəxsləri Allah-Təalanın şiddətli əzabı ilə müjdələ.** (Bu müjdə istehza etmək üçündür, yoxsa müjdə şad xəbər üçün olar, əzab üçün deyil).

**4)** (إِلَّا الَّذِينَ عَاهَدْتُمْ مِنَ الْمُشْرِكِينَ ثُمَّ لَمْ يَنْقُصُوكُمْ شَيْئًا) – **müşriklər xəyanət etdiklərinə görə, onların əhdi batil olub, onlara 4 ay vaxt verildi. Ancaq əhd etdiyiniz o müşriklər ki, əhdlərinə sadiq qalıb, sizinlə etdikləri əhdə xəyanət etməyib və pozmayıblar,** (وَلَمْ يُظَاهِرُوا عَلَيْكُمْ أَحَدًا) – **və sizin**

فَأَتِمُّوا إِلَيْهِمْ عَهْدَهُمْ إِلَى مُدَّتِهِمْ إِنَّ اللَّهَ يُحِبُّ الْمُتَّقِينَ ﴿٤﴾ فَإِذَا انْسَلَخَ الْأَشْهُرُ الْحُرُمُ فَاقْتُلُوا
الْمُشْرِكِينَ حَيْثُ وَجَدْتُمُوهُمْ وَخُذُوهُمْ وَاحْصُرُوهُمْ وَاقْعُدُوا لَهُمْ كُلَّ مَرْصَدٍ فَإِنْ تَابُوا وَأَقَامُوا
الصَّلَاةَ وَآتَوُا الزَّكَاةَ فَخَلُّوا سَبِيلَهُمْ إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ ﴿٥﴾ وَإِنْ أَحَدٌ مِنَ الْمُشْرِكِينَ اسْتَجَارَكَ
فَأَجِرْهُ حَتَّى يَسْمَعَ كَلَامَ اللَّهِ ثُمَّ أَبْلِغْهُ مَأْمَنَهُ ذَلِكَ بِأَنَّهُمْ قَوْمٌ لَا يَعْلَمُونَ ﴿٦﴾

---

**düşmənlərinizdən heç kimə sizin zərər etmək üçün kömək etməyiblər, (فَأَتِمُّوا إِلَيْهِمْ عَهْدَهُمْ إِلَى مُدَّتِهِمْ) – belə müşriklərin əhdinə verdiyiniz vaxta kimi vəfa edib tamamlayın.** (Məkkənin ətrafında olan müşriklərdən bəni-Damrə və bəni-Kinanə camaatları əhdlərinə sadiq qalmışdılar, əhdlərinin sonuna hələ 9 ay var idi). **(إِنَّ اللَّهَ يُحِبُّ الْمُتَّقِينَ) – Allah-Təaladan qorxub sizə xəyanət etməyən müşriklərlə etdiyiniz əhdi qoruyun, həqiqətən, Allah-Təala onun hökmlərinə əməl edən müttəqi şəxsləri sevər.**

**5) (فَإِذَا انْسَلَخَ الْأَشْهُرُ الْحُرُمُ)** – (o 4 ay ki müşriklərə möhlət verilmişdi o 4 ayda onlarla savaşmaq haram idi)**, elə ki o 4 ay (şəvval, zülqədə, zülhiccə, Məhərrəm) bitib qurtardı,** (müşriklərin də vaxtı qurtardı)**. (فَاقْتُلُوا الْمُشْرِكِينَ حَيْثُ وَجَدْتُمُوهُمْ) – o 4 aydan sonra müşrikləri harda tapsanız,** (əgər tövbə edib şirkdən dönməsələr)**, onları qətlə yetirin, (وَخُذُوهُمْ وَاحْصُرُوهُمْ) – əgər həbs etmək məsləhət olsa, müşrikləri tutub, əsir edib həbsə salın, (وَاقْعُدُوا لَهُمْ كُلَّ مَرْصَدٍ) – onların gəlib-getdiyi hər bir yerdə oturun ki, onları əsir edib tutasınız. (فَإِنْ تَابُوا وَأَقَامُوا الصَّلَاةَ وَآتَوُا الزَّكَاةَ) – əgər müşriklər tövbə edib namaz qılıb, zəkat versələr, (فَخَلُّوا سَبِيلَهُمْ) – onların yollarını boşaldıb azad edin, çünki onlar da sizin kimi müsəlman oldular. (إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ) – həqiqətən, Allah-Təala islama daxil olduqları üçün onların keçmiş günahlarını bağışlayıb onlara rəhm edəndir.**

**6) (وَإِنْ أَحَدٌ مِنَ الْمُشْرِكِينَ اسْتَجَارَكَ)** – (ey Məhəmməd)**, əgər müşriklərin vaxtı bitəndən sonra müşriklərdən bir nəfər sənin yanına gəlib** (səni eşitmək üçün) **səndən aman istəsə, (فَأَجِرْهُ حَتَّى يَسْمَعَ كَلَامَ اللَّهِ) – sən o müşrikə aman ver ki, gəlib Allah-Təala kəlamını eşitsin. (ثُمَّ أَبْلِغْهُ مَأْمَنَهُ) – ondan sonra əgər imana daxil olsa, çox gözəl, əgər imana daxil olmasa, öz vətəninə getməyə ehtiyat etsə,** (ey Məhəmməd)**, sən onu özünün əmin olduğu yerə çatdır ki, yolda müsəlmanlar ona bir əziyyət etməsin.** (İnsaflı şəxslər bir bu sözlərə baxıb insaf edib, diqqətlə baxsınlar, haqq üzrə olmayan şəxs belə hərəkət edərmi, halbuki həmin müşriklər Hz. Peyğəmbərə nə qədər xəyanət və əziyyət ediblər? O həzrət isə onlara heç vaxt xəyanət etmədi. Hər zaman verdiyi sözə sadiq oldu). **(ذَلِكَ بِأَنَّهُمْ قَوْمٌ لَا يَعْلَمُونَ) – onlara aman vermək lazımdır, çünki müşriklər cahil və nadan bir camaatdır. Heç bir elmləri yoxdur.** (Onlara aman vermək lazımdır ki, Allah-Təalanın sözlərini eşidib bilsinlər və onlarla dost kimi hərəkət edin ki, bəlkə, imana daxil olsunlar).

كَيْفَ يَكُونُ لِلْمُشْرِكِينَ عَهْدٌ عِنْدَ اللهِ وَعِنْدَ رَسُولِهِ إِلَّا الَّذِينَ عَاهَدْتُمْ عِنْدَ الْمَسْجِدِ الْحَرَامِ فَمَا اسْتَقَامُوا لَكُمْ فَاسْتَقِيمُوا لَهُمْ إِنَّ اللهَ يُحِبُّ الْمُتَّقِينَ ﴿٧﴾ كَيْفَ وَإِنْ يَظْهَرُوا عَلَيْكُمْ لَا يَرْقُبُوا فِيكُمْ إِلًّا وَلَا ذِمَّةً يُرْضُونَكُمْ بِأَفْوَاهِهِمْ وَتَأْبَى قُلُوبُهُمْ وَأَكْثَرُهُمْ فَاسِقُونَ ﴿٨﴾

---

**7) (كَيْفَ يَكُونُ لِلْمُشْرِكِينَ عَهْدٌ عِنْدَ اللهِ وَعِنْدَ رَسُولِهِ) - xəyanət edən müşriklərin Allah-Təala və onun peyğəmbərinin yanında necə əhdi ola bilər?** (Xəyanətkar şəxsdən ötrü heç vaxt əhd olmaz). **(إِلَّا الَّذِينَ عَاهَدْتُمْ عِنْدَ الْمَسْجِدِ الْحَرَامِ) - Məscidül-haramın yanında əhd etdiyiniz** (bəni-Damrə və bəni-Kinanə) **müşriklərdən başqa, heç bir müşrikdən ötrü əhd yoxdur, çünki onlar əhdlərinə sadiq qalıb onu pozmayıblar). (فَمَا اسْتَقَامُوا لَكُمْ) - nə qədər ki onlar sizinlə olan əhdlərində dürüst və möhkəm durublar, (فَاسْتَقِيمُوا لَهُمْ) - siz də onlardan ötrü möhkəm durun. (إِنَّ اللهَ يُحِبُّ الْمُتَّقِينَ) - həqiqətən, Allah-Təala müttəqi və dürüst şəxsləri sevər.**

**8) (كَيْفَ) - xəyanətkar müşriklərdən ötrü necə əhd ola bilər, (وَإِنْ يَظْهَرُوا عَلَيْكُمْ لَا يَرْقُبُوا فِيكُمْ إِلًّا وَلَا ذِمَّةً) - halbuki** (onlar elə dinsiz şəxslərdirlər ki, siz müsəlmanlarla əhdləri olduğu halda) **sizə gücləri çatsa, sizə qalib ola bilsələr, sizin haqqınızda içdikləri andlarını və əhdlərini düşünməyib,** (sizə rəhm etməzlər və sizi tamamən qətlə yetirərlər. İndi ki onlar əhdlərinə sadiq olmayacaqlar, siz nədən ötrü sadiq olasınız? Ta ki onlar sizi qəflətə salıb, qəfildən sizə zərər yetirməsinlər). **(يُرْضُونَكُمْ بِأَفْوَاهِهِمْ) - müşriklərin zahirləri, batinləriylə müvafiq deyil, ağızlarından çıxan sözlə sizi razı salarlar ki, biz əhdimizdə sabit olub heç vaxt əhdi pozmarıq, amma qəlbləri onu qəbul etməyib, qəlblərində xəyanət vardır. (وَتَأْبَى قُلُوبُهُمْ وَأَكْثَرُهُمْ فَاسِقُونَ) - müşriklərin çoxu* fasiqdir. Nə əhdlərinə sadiq olandırlar, nə də sözlərinin etibarı vardır.**

*(*Qeyd:* *Fisq - küfr və şirkdən fərqlidir. Ola bilər ki, bir adam kafir və müşrik olsun, amma fasiq olmasın. Ola bilər ki, bir şəxs müsəlman olsun, amma fasiq olsun, hansı dində olursa olsun, əgər o əmanətə və verdiyi sözə sadiq deyilsə, müsəlman da olsa, fasiqdir).*

(Qurani-Şərifdə bu surədən başqa, heç bir yerdə heç bir qövmün haqqında qətl hökmü verilməyibdir, bu hökm də ayədə açıq-aşkar göstərildiyi kimi, əhdi pozub xəyanət edən müşriklərə aiddir. Əlbəttə, siyasətin şərtinə görə, xəyanət edənlərə, gərək, cəza verilsin. Müşriklərdən başqa heç bir qövmün haqqında qətl hökmü verilməyibdir. Əgər islamda zülm olub, insanlar zorla islam dinini qəbul etməyə məcbur edilsəydi, şəriət sahibi, gərək, birinci növbədə öz qövmünü (müşrikləri) qoruyub, onlara yaxşılıq edib, özgə qövmlərə (əhli-kitab olanlara) bu hökmü verəydi, halbuki özgə qövmlərə əhli-kitab olduqları üçün hörmət etməyi vəsiyyət edib, öz tayfası müşrik olduğu üçün onların qətlinə hökm veribdir. Bu mətləb siyasətə müvafiqdir və ədalətlə rəftar etməkdən qaynaqlanır. Diqqət edilsin).

اشْتَرَوْا بِآَيَاتِ اللَّهِ ثَمَنًا قَلِيلًا فَصَدُّوا عَنْ سَبِيلِهِ إِنَّهُمْ سَاءَ مَا كَانُوا يَعْمَلُونَ ﴿٩﴾ لَا يَرْقُبُونَ فِي مُؤْمِنٍ
إِلًّا وَلَا ذِمَّةً وَأُولَئِكَ هُمُ الْمُعْتَدُونَ ﴿١٠﴾ فَإِنْ تَابُوا وَأَقَامُوا الصَّلَاةَ وَآَتَوُا الزَّكَاةَ فَإِخْوَانُكُمْ فِي الدِّينِ
وَنُفَصِّلُ الْآَيَاتِ لِقَوْمٍ يَعْلَمُونَ ﴿١١﴾ وَإِنْ نَكَثُوا أَيْمَانَهُمْ مِنْ بَعْدِ عَهْدِهِمْ وَطَعَنُوا فِي دِينِكُمْ فَقَاتِلُوا
أَئِمَّةَ الْكُفْرِ إِنَّهُمْ لَا أَيْمَانَ لَهُمْ لَعَلَّهُمْ يَنْتَهُونَ ﴿١٢﴾ أَلَا تُقَاتِلُونَ قَوْمًا نَكَثُوا أَيْمَانَهُمْ وَهَمُّوا بِإِخْرَاجِ
الرَّسُولِ وَهُمْ بَدَءُوكُمْ أَوَّلَ مَرَّةٍ أَتَخْشَوْنَهُمْ فَاللَّهُ أَحَقُّ أَنْ تَخْشَوْهُ

---

**9) (اشْتَرَوْا بِآَيَاتِ اللَّهِ ثَمَنًا قَلِيلًا) – müşriklər az dəyəri olan nəfsani arzulara tabe olmağı Qurani-Şərifə və islam dininə üstün sayıb, inad və təkəbbürlərindən iman gətirmədilər. (فَصَدُّوا عَنْ سَبِيلِهِ) – özləri iman gətirməməklə birlikdə, başqalarının da Allah-Təalaya iman gətirməsinə mane oldular. (إِنَّهُمْ سَاءَ مَا كَانُوا يَعْمَلُونَ) – həqiqətən, müşriklər nə pis əməl edib, inadkarlıq ilə nəfsani arzuları Allah-Təalanın dininə üstün sayırlar.**

**10) (لَا يَرْقُبُونَ فِي مُؤْمِنٍ إِلًّا وَلَا ذِمَّةً) – müşriklər heç bir mömin haqqında içdikləri andlarını düşünməyib, fürsət tapınca əhdlərini pozarlar. (وَأُولَئِكَ هُمُ الْمُعْتَدُونَ) – zülm və şərdə həddi aşanlar bu müşriklərdir.**

**11) (فَإِنْ تَابُوا وَأَقَامُوا الصَّلَاةَ وَآَتَوُا الزَّكَاةَ) – əgər müşriklər tövbə edib islam dininə daxil olub namaz qılıb zəkat versələr, (فَإِخْوَانُكُمْ فِي الدِّينِ) – o zaman islam dinində sizin qardaşlarınızdırlar. Onlara heç bir zərər yetirə bilməzsiniz. (وَنُفَصِّلُ الْآَيَاتِ لِقَوْمٍ يَعْلَمُونَ) – müşriklərin hökmlərini agah olan camaatdan ötrü bəyan edirik ki, müşriklərlə necə rəftar edəcəklərini bilsinlər.**

**12) (وَإِنْ نَكَثُوا أَيْمَانَهُمْ مِنْ بَعْدِ عَهْدِهِمْ) – əgər müşriklər öz andlarını sizinlə əhd edəndən sonra pozsalar, (وَطَعَنُوا فِي دِينِكُمْ) – sizin dininizə** (islama) **tənə edib, eyib tutsalar, (فَقَاتِلُوا أَئِمَّةَ الْكُفْرِ) – o zaman sizin dininizə tənə edib, əhdlərini pozduqlarına görə, müşriklərin rəisləriylə savaşın,** (hər bir yerdə rəhbərlər öndə olar), **(إِنَّهُمْ لَا أَيْمَانَ لَهُمْ) – həqiqətən, onlardan ötrü and yoxdur və andları and deyil, əgər həqiqətən, and olsaydı, əhdlərini pozmazdılar. (لَعَلَّهُمْ يَنْتَهُونَ) – onlarla savaşın ki, bəlkə, küfrdən dönüb imana daxil olsunlar.**

**13) (أَلَا تُقَاتِلُونَ قَوْمًا نَكَثُوا أَيْمَانَهُمْ) –** (ey möminlər)**, and içib sizinlə etdikləri əhdlərini pozan bir camaatla** (Məkkəli Qüreyş camaatı ilə) **savaşmazsınızmı? (وَهَمُّوا بِإِخْرَاجِ الرَّسُولِ) – həm də bizim peyğəmbəri (Hz. Məhəmmədi) Məkkədən çıxarmaq istəmişdilər, (وَهُمْ بَدَءُوكُمْ أَوَّلَ مَرَّةٍ) – Qüreyş camaatı öncə özləri sizinlə savaşmağa başladılar, (savaşa ilk başlayan zalımdır, zalıma qarşı çıxıb, onun zülmünü dəf etmək lazımdır, Hz. Peyğəmbərin bütün savaşları bu səbəbdən olub, heç vaxt savaşa ilk başlayan o olmamışdır. (أَتَخْشَوْنَهُمْ) – yoxsa müşriklərdən qorxursunuz? (فَاللَّهُ أَحَقُّ أَنْ تَخْشَوْهُ) –**

إِنْ كُنْتُمْ مُؤْمِنِينَ ﴿١٣﴾ قَاتِلُوهُمْ يُعَذِّبْهُمُ اللّٰهُ بِأَيْدِيكُمْ وَيُخْزِهِمْ وَيَنْصُرْكُمْ عَلَيْهِمْ وَيَشْفِ صُدُورَ قَوْمٍ
مُؤْمِنِينَ ﴿١٤﴾ وَيُذْهِبْ غَيْظَ قُلُوبِهِمْ وَيَتُوبُ اللّٰهُ عَلَى مَنْ يَشَاءُ وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ ﴿١٥﴾ أَمْ حَسِبْتُمْ
أَنْ تُتْرَكُوا وَلَمَّا يَعْلَمِ اللّٰهُ الَّذِينَ جَاهَدُوا مِنْكُمْ وَلَمْ يَتَّخِذُوا مِنْ دُونِ اللّٰهِ وَلَا رَسُولِهِ وَلَا الْمُؤْمِنِينَ
وَلِيجَةً وَاللّٰهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ ﴿١٦﴾

---

**Allah-Təala ondan qorxulmağa daha layiqdir,** (إِنْ كُنْتُمْ مُؤْمِنِينَ) – **əgər Allah-Təalaya iman gətirənsinizsə.**

**14)** (قَاتِلُوهُمْ يُعَذِّبْهُمُ اللّٰهُ بِأَيْدِيكُمْ) – **əlbəttə, müşriklərlə cihad edin, Allah-Təala sizin əlinizlə onlara əzab edəcəkdir,** (وَيُخْزِهِمْ وَيَنْصُرْكُمْ عَلَيْهِمْ) – **və möminlərə kömək edib,** (وَيَشْفِ صُدُورَ قَوْمٍ مُؤْمِنِينَ) – **müşrikləri zəlil edib, mömin bir tayfanın** (Xüzaə qəbiləsinin müsəlmanlarının) **sinələrində olan dərdə şəfa verəcəkdir.** (Qüreyş camaatı Xüzaə qəbiləsinə əziyyət edirdi. Xüzaə camaatının müşrikləri və möminləri Hz. Peyğəmbərlə müttəfiq olub əhd etmişdilər. Bəni-Bəkir qəbiləsinin camaatı Qüreyşlə müttəfiq olub əhd etmişdilər. Bəni-Bəkir Xüzaə ilə savaşmağa getdi. Qüreyş camaatı Hz. Peyğəmbərlə savaşmamaq üçün əhd etdikləri halda, əhdi pozub Bəni-Bəkirə kömək etdi. Xüzaədən bir nəfər Mədinəyə gedib, bunu Hz. Peyğəmbərə xəbər verdi. Qüreyşin əhdi pozduğu məlum oldu. Hz. Peyğəmbər gedib Məkkəni fəth etdi).

**15)** (وَيُذْهِبْ غَيْظَ قُلُوبِهِمْ ) – **müşriklər zəlil olduğu üçün Allah-Təala o möminlərin** (Xüzaə möminlərinin) **qəlblərində olan qeyz və qəzəbi silib rahat olarlar.** (وَيَتُوبُ اللّٰهُ عَلَى مَنْ يَشَاءُ) – **Allah-Təala kimi istəsə,** (o şəxs tövbəyə qabil olsa)**, Allah-Təala yardım edib, tövbəni ona qismət edər, imana daxil olar.** (Necə ki Məkkə əhlindən bəziləri imana daxil oldular). (وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ) – **Allah-Təala agahdır ki, bundan sonra kim imana daxil olub, kim daxil olmayacaq. Allah-Təalanın etdiyi hər bir əməl hikmət üzrə meydana gələr.**

**16)** (أَمْ حَسِبْتُمْ أَنْ تُتْرَكُوا) – (ey möminlər)**, siz belə güman etdiniz ki, öz halınızda qalıb cihad etməklə məsul olmayacaqsınız?** (Amma gərək itaətdə olan və olmayan məlum olsun). (Şəxsin təmiz qəlbli olub-olmaması bu cür imtahanla məlum olar). (وَلَمَّا يَعْلَمِ اللّٰهُ الَّذِينَ جَاهَدُوا مِنْكُمْ) – **necə ola bilər ki, Allah-Təala sizi cihadla məsul etməsin? Halbuki cihada getməmiş Allah-Təala yanında cihad edən şəxslər sizə məlum olmayıbdır.** (Cihadla əmr olunmasanız, Allah-Təala yanında kim əsl mücahiddir, onu bilməzsiniz). (وَلَمْ يَتَّخِذُوا مِنْ دُونِ اللّٰهِ وَلَا رَسُولِهِ وَلَا الْمُؤْمِنِينَ وَلِيجَةً) **- bir də əgər cihadla əmr olunmasanız, Allah-Təaladan, onun peyğəmbərindən və möminlərdən başqasını** (müşrikləri) **özlərinə dost tutmayan şəxslər məlum olmazlar.** (Gərək, cihadla əmr olunasınız ki, xalis mömin saxta mömindən ayırd edilsin). (وَاللّٰهُ خَبِيرٌ بِمَا تَعْمَلُونَ) – **siz möminlərin etdiyi əməllərdən Allah-Təala agah və xəbərdardır, bilir**

**مَا كَانَ لِلْمُشْرِكِينَ أَنْ يَعْمُرُوا مَسَاجِدَ اللهِ شَاهِدِينَ عَلَى أَنْفُسِهِمْ بِالْكُفْرِ أُولَئِكَ حَبِطَتْ أَعْمَالُهُمْ وَفِي النَّارِ هُمْ خَالِدُونَ ﴿١٧﴾**

---

**ki, o əməlləri Allah-Təaladan ötrü edirsiniz, yoxsa yox?** (Bədir savaşında müşrikləri əsir edəndən sonra müsəlmanlar onlara çox məzəmmət etdilər. Əli ibn Əbu Talib əmisi Abbası məzəmmət etdi ki, sən qohumluq bağını kəsib, qardaşın oğlu Məhəmmədlə savaşmağa gəldin. Bu nə əməldir, etmisən? Abbas dedi: "Doğrudur, biz islama daxil olmadıq, amma bizim də yaxşı əməllərimiz var, Məkkədə Allah-Təalanın məscidini (Məscidül-haramı) təmir edirdik. Hacılara kömək edib onlara Zəmzəmdən su verirdik, ac olan hacılara yemək verirdik. Bunlar bizim etdiyimiz xeyir əməllərdir, sıradakı ayə bu barədə nazil oldu).

**17) (مَا كَانَ لِلْمُشْرِكِينَ أَنْ يَعْمُرُوا مَسَاجِدَ اللّٰهِ) – müşriklərdən ötrü Allah-Təalanın məscidlərini təmir etmək caiz və səhih deyildir.** (Yəni onların məscidi təmir etməsi xeyir əməl hesab olunmaz). **(شَاهِدِينَ عَلَى أَنْفُسِهِمْ بِالْكُفْرِ) – bir halda ki özləri özlərinin* kafir olduqlarına şəhadət edirlər, necə ola bilər ki, Allah-Təalanı inkar edib Onun məscidlərini təmir etsinlər? (أُولَئِكَ حَبِطَتْ أَعْمَالُهُمْ) – bu qeyd olunan müşriklər xeyir əməl etsələr də, onların bütün əməlləri batildir. Onlara bir faydası olmaz. (وَفِي النَّارِ هُمْ خَالِدُونَ) – özləri də həmişə cəhənnəm odunda əzab içində olacaqlar.**

*(*Qeyd:* *Hərçənd müşriklər dilləri ilə - "Allah-Təalanı inkar edirik," demirdilər - amma əməlləri onların kafir olduqlarını göstərirdi. Bütlərini Kəbənin ətrafına düzmüşdülər. Hər dəfə gəlib Kəbəni tavaf edəndən sonra gedib bütlərin qabağında səcdə edib bu sözləri oxuyardular: "İlahi, sənin hüzur və xidmətində durmuşuq, sənin şərikin yoxdur. Ancaq bu bütlər də sənin ixtiyarındadırlar, o bütlərin özlərinə və malik olduqları şeylərə də sən sahibsən". Bu əməllərinə görə, Allah-Təala onlara müşrik deyir. Əgər müşrik budursa, biz müsəlmanlar ilk müşrik hesab olunmalıyıq. Bəs biz Allah-Təaladan başqasına səcdə edib, yardım istəmirik? Bu müşriklərin dediyi sözləri demirik? Din və məzhəb rəhbərlərinin haqqında o qədər həddi aşan sözlər demişik ki, diqqətlə baxanda onları Allah-Təalaya şərik qoşduğumuz aydın olur. Halbuki Allah-Təala öz müqəddəs kitabında Hz. Peyğəmbərə vəhyi təbliğdən başqa bir mənsəb bəxş etməyibdir. Ağıl sahibi şəxslər bilirlər ki, mən həqirin məqsədi nədir. Müqəddəs peyğəmbərlər bəzən sözlərini rəmzlərlə ifadə ediblər. Hz. Peyğəmbər bir gün məsciddə bəzi yaxın səhabələri ilə söhbət edirdi. O vaxt başqa bir şəxs də içəri daxil oldu, Hz. Peyğəmbər buyurdu: "Qablarınızı örtün". Bu hədisin mənasını Hafiz Şirazi belə ifadə etmişdir:*

*Üns məclisində naməhrəm söhbətinin yeri yoxdur,*
*Piyalənin başını bağla ki, xirqəgeyinən gəldi.*

*Bu hədisin mənasını heç kim bu cür gözəl izah etməmişdir (Allah ona rəhmət etsin). Ümidvarıq ki, zamanla cəhalət yox olub, sözlərin rəmzi mənaları açıq-aşkar*

**إِنَّمَا يَعْمُرُ مَسَاجِدَ اللَّهِ مَنْ آمَنَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَأَقَامَ الصَّلَاةَ وَآتَى الزَّكَاةَ وَلَمْ يَخْشَ إِلَّا اللَّهَ فَعَسَى**
**أُولَئِكَ أَنْ يَكُونُوا مِنَ الْمُهْتَدِينَ ﴿١٨﴾ أَجَعَلْتُمْ سِقَايَةَ الْحَاجِّ وَعِمَارَةَ الْمَسْجِدِ الْحَرَامِ كَمَنْ آمَنَ بِاللَّهِ**
**وَالْيَوْمِ الْآخِرِ وَجَاهَدَ فِي سَبِيلِ اللَّهِ لَا يَسْتَوُونَ عِنْدَ اللَّهِ وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ ﴿١٩﴾ الَّذِينَ آمَنُوا**
**وَهَاجَرُوا وَجَاهَدُوا فِي سَبِيلِ اللَّهِ بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ أَعْظَمُ دَرَجَةً عِنْدَ اللَّهِ وَأُولَئِكَ هُمُ الْفَائِزُونَ ﴿٢٠﴾**

---

*ortaya qoyular. Bu mübarək kitabda da ayələrin təfsirindəki məxfi mətləblərə bəzən rəmzlə, bəzən də açıq-aşkar işarə edilibdir, ağıl sahibləri diqqət etsinlər. Bu mübarək təfsiri oxuyan şəxslər hərçənd başlanğıcda ondan çəkinib üz döndərəcəklər, amma elə bir zaman gələcək ki, can-başla bu kitaba aşiq olub ona bədəndə olan ruh kimi dəyər verəcəklər, o şəxslər üçün dua edib sonsuz salam göndəririrəm.*

*Yüz ildən sonra əgər desən ki, o haradadır,*
*Hər bir beytdən nida gələr ki, odur bu.*
*Barama qurdu kimi etdiklərimdən ipək oldum,*
*Toxuyub bağışlayaram bir yarpaqdan iplik.*

*Şeyx Nizaminin bu kəlamı müəlliflərin əhvalını bəyan edir. Allah ona rəhmət etsin).*

**18) (إِنَّمَا يَعْمُرُ مَسَاجِدَ اللَّهِ مَنْ آمَنَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ) – həqiqətən, Allah-Təalanın məscidlərini təmir edib ondan faydalananlar ancaq Allah-Təalaya və axirət gününə iman gətirənlərdir, (وَأَقَامَ الصَّلَاةَ وَآتَى الزَّكَاةَ) – namazı qılıb zəkat verənlərdir, (وَلَمْ يَخْشَ إِلَّا اللَّهَ) – Allah-Təaladan başqasından qorxmazlar, (فَعَسَى أُولَئِكَ أَنْ يَكُونُوا مِنَ الْمُهْتَدِينَ) – belə şəxslər, gərək, ümidvar olsunlar ki, hidayət tapan şəxslərdən olub axirətdə nicat tapacaqlar.** (Belə əməl sahibi olmayanlardan ötrü buyurur ki, tamahkar şəxslər nicat tapmağa ümidvar olub kamil iman məqamına yetişə bilməzlər).

**19) (أَجَعَلْتُمْ سِقَايَةَ الْحَاجِّ وَعِمَارَةَ الْمَسْجِدِ الْحَرَامِ كَمَنْ آمَنَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَجَاهَدَ فِي سَبِيلِ اللَّهِ) – bəs siz hacılara Zəmzəmdən su verən və Məscidül-haramı təmir edən müşrikləri Allah-Təalaya və axirət gününə iman gətirib Allah-Təala yolunda cihad edən möminlərlə eynimi saydınız? (لَا يَسْتَوُونَ عِنْدَ اللَّهِ) – heç vaxt onlar Allah-Təala yanında bərabər olmazlar. (وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ) – Allah-Təala zalım olan camaatı** (müşrikləri) **zülm etdikləri müddətcə haqq tərəfinə hidayət etməz.**

**20) (الَّذِينَ آمَنُوا وَهَاجَرُوا) – o şəxslər ki iman gətirib hicrət edirlər, (وَجَاهَدُوا فِي سَبِيلِ اللَّهِ بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ) – və Allah-Təala yolunda malları və canları ilə cihad edərlər, (أَعْظَمُ دَرَجَةً عِنْدَ اللَّهِ) – Allah-Təala yanında böyük dərəcə sahibləri bu şəxslərdir, nəinki Məscidül-haramı təmir edib hacılara Zəmzəmdən su verən müşriklər. Müşriklərin heç bir xeyir əməli Allah-Təala yanında fayda verən deyildir. (وَأُولَئِكَ هُمُ الْفَائِزُونَ) – əlbəttə, axirətdə nicat tapıb böyük lütfə yetişən onlardır, nəinki müşriklər.**

**يُبَشِّرُهُمْ رَبُّهُمْ بِرَحْمَةٍ مِنْهُ وَرِضْوَانٍ وَجَنَّاتٍ لَهُمْ فِيهَا نَعِيمٌ مُقِيمٌ ﴿٢١﴾ خَالِدِينَ فِيهَا أَبَدًا إِنَّ اللَّهَ عِنْدَهُ أَجْرٌ عَظِيمٌ ﴿٢٢﴾ يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَتَّخِذُوا آبَاءَكُمْ وَإِخْوَانَكُمْ أَوْلِيَاءَ إِنِ اسْتَحَبُّوا الْكُفْرَ عَلَى الْإِيمَانِ وَمَنْ يَتَوَلَّهُمْ مِنْكُمْ فَأُولَئِكَ هُمُ الظَّالِمُونَ ﴿٢٣﴾ قُلْ إِنْ كَانَ آبَاؤُكُمْ وَأَبْنَاؤُكُمْ وَإِخْوَانُكُمْ وَأَزْوَاجُكُمْ وَعَشِيرَتُكُمْ وَأَمْوَالٌ اقْتَرَفْتُمُوهَا وَتِجَارَةٌ تَخْشَوْنَ كَسَادَهَا وَمَسَاكِنُ تَرْضَوْنَهَا أَحَبَّ إِلَيْكُمْ مِنَ اللَّهِ وَرَسُولِهِ وَجِهَادٍ فِي سَبِيلِهِ فَتَرَبَّصُوا حَتَّى يَأْتِيَ اللَّهُ بِأَمْرِهِ وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ ﴿٢٤﴾ لَقَدْ نَصَرَكُمُ اللَّهُ فِي مَوَاطِنَ كَثِيرَةٍ**

---

**21) (يُبَشِّرُهُمْ رَبُّهُمْ بِرَحْمَةٍ مِنْهُ وَرِضْوَانٍ وَجَنَّاتٍ لَهُمْ فِيهَا نَعِيمٌ مُقِيمٌ) – qeyd olunan möminlərin rəbbi Allah-Təala onları öz tərəfindən rəhmət və rahatlıqla, içərisində əbədi nemətlər olan cənnətlərlə müjdələyir.**

**22) (خَالِدِينَ فِيهَا أَبَدًا) – o cənnətlərdə həmişə olub, heç vaxt oradan çıxmazlar. (إِنَّ اللَّهَ عِنْدَهُ أَجْرٌ عَظِيمٌ) – həqiqətən, böyük əcr və savab Allah-Təala yanındadır. O savaba ancaq saleh əməllə çatmaq olar.**

**23) (يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَتَّخِذُوا آبَاءَكُمْ وَإِخْوَانَكُمْ أَوْلِيَاءَ إِنِ اسْتَحَبُّوا الْكُفْرَ عَلَى الْإِيمَانِ) – ey iman gətirənlər, küfrü imana üstün sayıb, küfr içində qalan atalarınızı və qardaşlarınızı özünüzə dost tutmayın. (وَمَنْ يَتَوَلَّهُمْ مِنْكُمْ) – sizdən kim o kafir olan qohum-əqrəbanı dost tutsa, (فَأُولَئِكَ هُمُ الظَّالِمُونَ) – əlbəttə, onları dost tutanlar zalımdırlar.**

**24) (قُلْ إِنْ كَانَ آبَاؤُكُمْ)** – (ey Məhəmməd)**, bu möminlərə de ki, əgər ölmüş atalarınız, (وَأَبْنَاؤُكُمْ) – oğullarınız, (وَإِخْوَانُكُمْ) – və qardaşlarınız, (وَأَزْوَاجُكُمْ) – və xanımlarınız. , (وَعَشِيرَتُكُمْ) – və sair qohum-əqrəbalarınız, (وَأَمْوَالٌ اقْتَرَفْتُمُوهَا) – və qazandığınız mallarınız, - (وَتِجَارَةٌ تَخْشَوْنَ كَسَادَهَا) və hicrət edən zaman kasad olmasından qorxduğunuz ticarətiniz, (وَمَسَاكِنُ تَرْضَوْنَهَا) – içərisində yaşamağı xoşladığınız evləriniz, (أَحَبَّ إِلَيْكُمْ مِنَ اللَّهِ وَرَسُولِهِ وَجِهَادٍ فِي سَبِيلِهِ) – əgər bu qeyd olunan şeylər sizin yanınızda Allah-Təaladan, onun peyğəmbərindən, onun yolunda cihad etməkdən daha sevimli olub, bu şeylərdən əl çəkməyib, cihada getməyib və hicrət etməsəniz, (فَتَرَبَّصُوا حَتَّى يَأْتِيَ اللَّهُ بِأَمْرِهِ) – o zaman Allah-Təalanın sizin haqqınızda olan əmri və əzabı gələnə qədər gözləyin, o vaxt sizə məlum olar. Amma Allah-Təala tərəfinə getmək yaxşıdır, yoxsa qeyd olunan bu şeyləri sevmək? (وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ) – Allah-Təala onun itaətindən çıxan fasiq şəxslərə hidayət etməz.** (Əlbəttə, insanın dini ondan ötrü, gərək, hər şeydən əziz olsun və əziz olan şeylərdən də din yolunda keçmək lazımdır).

**25) (لَقَدْ نَصَرَكُمُ اللَّهُ فِي مَوَاطِنَ كَثِيرَةٍ) – həqiqətən, Allah-Təala siz müsəlmanlara bir çox savaşlarda kömək etdi.** (Hz. Peyğəmbərin 80 savaşı olubdur, hamısında da Allah-Təala müsəlmanlara kömək olubdur). **xüsusən* Huneyn**

وَيَوْمَ حُنَيْنٍ إِذْ أَعْجَبَتْكُمْ كَثْرَتُكُمْ فَلَمْ تُغْنِ عَنْكُمْ شَيْئًا وَضَاقَتْ عَلَيْكُمُ الْأَرْضُ بِمَا رَحُبَتْ ثُمَّ وَلَّيْتُمْ
مُدْبِرِينَ ﴿٢٥﴾ ثُمَّ أَنْزَلَ اللهُ سَكِينَتَهُ عَلَى رَسُولِهِ وَعَلَى الْمُؤْمِنِينَ وَأَنْزَلَ جُنُودًا لَمْ تَرَوْهَا وَعَذَّبَ
الَّذِينَ كَفَرُوا وَذَلِكَ جَزَاءُ الْكَافِرِينَ ﴿٢٦﴾ ثُمَّ يَتُوبُ اللهُ مِنْ بَعْدِ ذَلِكَ عَلَى مَنْ يَشَاءُ

---

**günü savaşında Allah-Təala sizə kömək etdi. Bu ayədə Allah-Təala müsəlmanların savaşda məğlub olduğunu xəbər verir. (وَيَوْمَ حُنَيْنٍ إِذْ أَعْجَبَتْكُمْ كَثْرَتُكُمْ) – O zaman ki sizin sayca çoxluğunuz sizi heyrətləndirdikdə - daha biz məğlub olmarıq - demişdiniz, Allah-Təala Huneyn savaşında sizə kömək etdi. (فَلَمْ تُغْنِ عَنْكُمْ شَيْئًا) – gördünüz ki, çox olmağınız sizə heç bir fayda verməyib, Allah-Təalaya möhtac olmaqdan sizi xilas etmədi. Zəfər və qələbə çox olmaqla deyil, bəlkə, Allah-Təaladandır. (وَضَاقَتْ عَلَيْكُمُ الْأَرْضُ بِمَا رَحُبَتْ) – o geniş yer sizə dar oldu, bilmədiniz ki, hansı tərəfə qaçasınız, (ثُمَّ وَلَّيْتُمْ مُدْبِرِينَ) – işiniz sıxıntıya düşəndən sonra düşmənə arxanızı çevirib qaçdınız.**

*(***Qeyd:** Huneyn - Məkkə ilə Taif arasında bir yerin adıdır. Məkkəni fəth edəndən sonra h. 8-ci ildə Hz. Peyğəmbərin o yerdə Saqif və Həvazin camaatıyla savaşı oldu. Hz. Peyğəmbərin 12 min nəfərlik qoşunu var idi. Müşriklər özləri 4 min nəfər idilər. Amma digər ərəb tayfalarından bir neçə min nəfər də onlara kömək üçün gəlmişdilər. Elə ki üzbəüz oldular, müsəlmanlar özlərinin çoxluğuna heyrət etdilər. Əbu Bəkir dedi: "Sayca çox olduğumuza görə, bu gün biz məğlub olmarıq". Elə ki savaş başladı, müsəlmanlar öz heyrətləri səbəbi ilə əvvəlcə məğlub olub, hətta bəziləri qaçıb Məkkəyə getdi. Savaş meydanında heç kim qalmayıb hamısı dağıldı. Ancaq Hz. Peyğəmbər özü yerində sabit durub, bir əmisi Abbas, bir də əmisi oğlu Süfyan ibn Haris Hz. Peyğəmbərin qatırının cilovuna yapışıb onun yanında durmuşdular. Hz. Peyğəmbər o gün Şəhba adlı ağ qatırına minmişdi. Buyurdu ki, "Ey Abbas, bu qaçanları çağır". Abbas gur səsli bir kişi idi. Səsləndi: "Ey mühacir və ənsar, Hz. Peyğəmbər burada durub, siz hara qaçırsınız?" elə ki Abbasın səsini eşitdilər, yenidən qayıdıb həmlə edib düşməni dağıtdılar. Bu Huneyn savaşı Hz. Peyğəmbərin şücaətinə açıq-aşkar bir dəlildir ki, hamı qaçdığı halda, Hz. Peyğəmbər yerində möhkəm durub geri çəkilmədi. Hz. Əli buyurur: "Hansı savaşda işimiz müşkül olsa, Hz. Peyğəmbərə pənah aparardıq").*

**26) (ثُمَّ أَنْزَلَ اللهُ سَكِينَتَهُ عَلَى رَسُولِهِ وَعَلَى الْمُؤْمِنِينَ) – ondan sonra Allah-Təala öz peyğəmbərinə və möminlərə təmkin, vüqar göndərdi,** (qəlbləri möhkəm olub savaşa qayıtdılar), **(وَأَنْزَلَ جُنُودًا لَمْ تَرَوْهَا) – elə bir qoşun (qəlb gücü, ruhani qüvvələr) göndərdi ki, heç görməyibsiniz. Allah-Təala sizə kömək göndərdi, (وَعَذَّبَ الَّذِينَ كَفَرُوا) – kafir şəxslərə əzab edib, onları sizin əlinizdə zəlil etdi. (وَذَلِكَ جَزَاءُ الْكَافِرِينَ) – kafirlərin dünyadakı cəzası budur. Axirət əzabı dünya əzabından artıq olacaqdır.**

**27) (ثُمَّ يَتُوبُ اللهُ مِنْ بَعْدِ ذَلِكَ عَلَى مَنْ يَشَاءُ) – kafirlərə əzab edəndən sonra Allah-Təala yerdə qalanlara, öz istədiyi şəxslərə tövbə** (imkanı) **verər. Əgər**

وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ ﴿٢٧﴾ يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا إِنَّمَا الْمُشْرِكُونَ نَجَسٌ فَلَا يَقْرَبُوا الْمَسْجِدَ الْحَرَامَ بَعْدَ
عَامِهِمْ هَذَا وَإِنْ خِفْتُمْ عَيْلَةً فَسَوْفَ يُغْنِيكُمُ اللّٰهُ مِنْ فَضْلِهِ إِنْ شَاءَ إِنَّ اللّٰهَ عَلِيمٌ حَكِيمٌ ﴿٢٨﴾ قَاتِلُوا
الَّذِينَ لَا يُؤْمِنُونَ بِاللّٰهِ وَلَا بِالْيَوْمِ الْآَخِرِ وَلَا يُحَرِّمُونَ مَا حَرَّمَ اللّٰهُ وَرَسُولُهُ وَلَا يَدِينُونَ دِينَ الْحَقِّ
مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ حَتَّى يُعْطُوا الْجِزْيَةَ عَنْ يَدٍ وَهُمْ صَاغِرُونَ ﴿٢٩﴾ وَقَالَتِ الْيَهُودُ عُزَيْرٌ ابْنُ
اللّٰهِ وَقَالَتِ النَّصَارَى الْمَسِيحُ ابْنُ اللّٰهِ

---

**tövbə etsələr, (**وَاللّٰهُ غَفُورٌ رَحِيمٌ**) – Allah-Təala tövbə edən şəxsləri bağışlayıb onlara rəhm edəndir.**

**28) (**يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا إِنَّمَا الْمُشْرِكُونَ نَجَسٌ**) – ey iman gətirənlər, həqiqətən, müşriklər, bütlərə sitayiş edənlər nəcisdir. Onlardan başqa heç bir tayfa hansı dində olursa olsun, nəcis deyil. (**فَلَا يَقْرَبُوا الْمَسْجِدَ الْحَرَامَ بَعْدَ عَامِهِمْ هَذَا **– müşriklər bu ildən sonra** (hicri 9-cu ildən) **Məscidül-hərama və Məkkəyə daxil olmasınlar. (**أَصْحَابَ**) – əgər siz Məkkədə olan müsəlmanlar müşriklərin gəlməməsi səbəbi ilə alış-veriş olmayıb, yoxsul olmaqdan qorxsanız, (**وَإِنْ خِفْتُمْ عَيْلَةً فَسَوْفَ يُغْنِيكُمُ اللّٰهُ مِنْ فَضْلِهِ إِنْ شَاءَ**) – Allah-Təalanın sizi öz lütf və kəraməti ilə zəngin edib, (sizdən ötrü başqa qapılar açması yaxındır. Müşriklərin alış-verişinə heç bir ehtiyac olmaz. Təbalə və Cürəş iki böyük camaatdırlar. Müsəlman olandan sonra Məkkəyə hər cür yemək gətirməyə başladılar, alış-veriş canlandı. Daha müşriklərə ehtiyacları olmadı). (**إِنَّ اللّٰهَ عَلِيمٌ حَكِيمٌ**) – həqiqətən, Allah-Təala sizin hər bir halınızdan agahdır.** (Ruzi verməsi və ya verməməsi hikmət üzrədir)**.**

**29) (**قَاتِلُوا الَّذِينَ لَا يُؤْمِنُونَ بِاللّٰهِ وَلَا بِالْيَوْمِ الْآَخِرِ وَلَا يُحَرِّمُونَ مَا حَرَّمَ اللّٰهُ وَرَسُولُهُ وَلَا يَدِينُونَ دِينَ الْحَقِّ**) – Allah-Təalaya və axirət gününə iman gətirməyib, Allah-Təalanın və onun peyğəmbərinin** (Hz. Məhəmmədin) **haram etdiyi şeyləri haram etməyib müsəlman olmayan şəxslərlə cihad edin. (**مِنَ الَّذِينَ أُوتُوا الْكِتَابَ**) – əhli kitabdan olan bu şəxslər o şəxslərdir ki, sizinlə əhd bağladıqları halda, ona xəyanət ediblər. (**حَتَّى يُعْطُوا الْجِزْيَةَ عَنْ يَدٍ وَهُمْ صَاغِرُونَ**) – əgər xəyanət etsələr, zəlil olaraq cizyə** (xərac) **verməyə razı olub, cizyə* verənə qədər, gərək, onlarla savaşasınız.**

*(*Qeyd:* *Əhli-kitab olanlar xəyanət etdikdə hökmləri müşriklərdən fərqlidir. Müşriklər xəyanət edəndə onlarla savaşarlar. Amma itaət etdiklərində onlardan cizyə alınıb şirk içində qalmalarına izin verməzlər. Amma əhli-kitab itaət etdikdə, cizyə (xərac) verib öz dinlərində qala bilərlər. Əgər əhdi pozmayıb xəyanət etməsələr, onlarla müsəlmanlar arasında heç bir fərq yoxdur, müsəlmanlara olan münasibət əhli-kitaba da şamildir).*

**30) (**وَقَالَتِ الْيَهُودُ عُزَيْرٌ ابْنُ اللّٰهِ**) – yəhudilər dedilər: “Üzeyir peyğəmbər Allah-Təalanın oğludur,” (**وَقَالَتِ النَّصَارَى الْمَسِيحُ ابْنُ اللّٰهِ**) – xristianlar dedilər: “İsa**

ذَلِكَ قَوْلُهُمْ بِأَفْوَاهِهِمْ يُضَاهِئُونَ قَوْلَ الَّذِينَ كَفَرُوا مِنْ قَبْلُ قَاتَلَهُمُ اللّٰهُ أَنَّى يُؤْفَكُونَ ﴿٣٠﴾ اتَّخَذُوا أَحْبَارَهُمْ وَرُهْبَانَهُمْ أَرْبَابًا مِنْ دُونِ اللّٰهِ وَالْمَسِيحَ ابْنَ مَرْيَمَ وَمَا أُمِرُوا إِلَّا لِيَعْبُدُوا إِلَهًا وَاحِدًا لَا إِلَهَ إِلَّا هُوَ سُبْحَانَهُ عَمَّا يُشْرِكُونَ ﴿٣١﴾ يُرِيدُونَ أَنْ يُطْفِئُوا نُورَ اللّٰهِ بِأَفْوَاهِهِمْ وَيَأْبَى اللّٰهُ إِلَّا أَنْ يُتِمَّ نُورَهُ وَلَوْ كَرِهَ الْكَافِرُونَ ﴿٣٢﴾ هُوَ الَّذِي أَرْسَلَ رَسُولَهُ بِالْهُدَى وَدِينِ الْحَقِّ لِيُظْهِرَهُ عَلَى الدِّينِ كُلِّهِ وَلَوْ كَرِهَ الْمُشْرِكُونَ ﴿٣٣﴾

---

**Məsih Allah-Təalanın oğludur”. (ذَلِكَ قَوْلُهُمْ بِأَفْوَاهِهِمْ) – bu bir mənasız sözdür ki, ağızlarında deyirlər, sözlərinin dəlil və sübutu yoxdur. (يُضَاهِئُونَ قَوْلَ الَّذِينَ كَفَرُوا مِنْ قَبْلُ) – onların bu mənasız sözləri özlərindən əvvəlki şəxslərin sözlərinə oxşardır, hansı ki Allah-Təalaya cürbəcür şəriklər isnad edirdilər. (قَاتَلَهُمُ اللّٰهُ أَنَّى يُؤْفَكُونَ) – Allah-Təalaya övlad isnad edənlərə layiqdir ki, belə deyilsin: “Allah-Təala onları öldürsün ki, haqdan dönüb, Allah-Təalaya layiq olmayan şeyləri isnad edirlər”.**

**31) (اتَّخَذُوا أَحْبَارَهُمْ وَرُهْبَانَهُمْ أَرْبَابًا مِنْ دُونِ اللّٰهِ) – əhli-kitab Allah-Təalanı buraxıb, öz alim və zahidlərini rəis və ixtiyar sahibi sayıb, onların haram, halalına itaət edib halalı haram, haramı halal etdilər.** (Necə ki bizim islam ümməti belə edib, haram və halalda öz rəhbərlərinə itaət edib, onların Qurana zidd olan hökmlərini qəbul edirlər). **(وَالْمَسِيحَ ابْنَ مَرْيَمَ) – və Məsih Məryəm oğlunu özlərinə məbud edib, Allah-Təalaya şərik saydılar. (وَمَا أُمِرُوا إِلَّا لِيَعْبُدُوا إِلَهًا وَاحِدًا) – halbuki bir olan Allah-Təalaya ibadət etməkdən başqa bir şeylə əmr olunmayıblar, (لَا إِلَهَ إِلَّا هُوَ) – Allah-Təaladan başqa haqq olan məbud yoxdur. (سُبْحَانَهُ عَمَّا يُشْرِكُونَ) – Allah-Təala ona şərik qoşulmaqdan pak və münəzzəhdir.**

**32) (يُرِيدُونَ أَنْ يُطْفِئُوا نُورَ اللّٰهِ بِأَفْوَاهِهِمْ) – müşriklərin istəyi odur ki, Allah-Təalanın əzəmətli olan nurunu** (Hz. Məhəmmədin peyğəmbərliyini) **ağızlarıyla söndürüb batil etsinlər.** (Allah-Təala Hz. Məhəmmədin peyğəmbərliyini böyük bir nura oxşadır. Müşriklərin təkzib və batil etmək niyyətlərini isə ağızdan çıxan yelə bənzədir, necə ki ağızdan çıxan yel o böyük nura təsir etməyəcəyi kimi onların məkr və hiylələri də Hz. Məhəmmədin peyğəmbərliyinə təsir etməz. Necə ki təsir etməyib hamısına qalib oldu). **(وَيَأْبَى اللّٰهُ إِلَّا أَنْ يُتِمَّ نُورَهُ) – amma Allah-Təala buna razı olmaz və öz nurunu (Hz. Məhəmmədin peyğəmbərliyini) tamamlayacaqdır.** (Allah-Təala öz istəyini yerinə yetirdi). **(وَلَوْ كَرِهَ الْكَافِرُونَ) – kafirlərin xoşuna gəlməsə də, Allah-Təala öz nurunu tamamlayacaqdır.**

**33) (هُوَ الَّذِي أَرْسَلَ رَسُولَهُ بِالْهُدَى وَدِينِ الْحَقِّ) – Allah-Təala öz peyğəmbərini** (Hz. Məhəmmədi) **hidayət və haqq olan dinlə göndərdi. (لِيُظْهِرَهُ عَلَى الدِّينِ كُلِّهِ) – ki, öz peyğəmbərini bütün dinlərə qalib etsin. (وَلَوْ كَرِهَ الْمُشْرِكُونَ) – müşriklər bundan xoşlanmasa da.**

**يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا إِنَّ كَثِيرًا مِنَ الْأَحْبَارِ وَالرُّهْبَانِ لَيَأْكُلُونَ أَمْوَالَ النَّاسِ بِالْبَاطِلِ وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللهِ وَالَّذِينَ يَكْنِزُونَ الذَّهَبَ وَالْفِضَّةَ وَلَا يُنْفِقُونَهَا فِي سَبِيلِ اللهِ فَبَشِّرْهُمْ بِعَذَابٍ أَلِيمٍ ﴿٣٤﴾ يَوْمَ يُحْمَى عَلَيْهَا فِي نَارِ جَهَنَّمَ فَتُكْوَى بِهَا جِبَاهُهُمْ وَجُنُوبُهُمْ وَظُهُورُهُمْ هَذَا مَا كَنَزْتُمْ لِأَنْفُسِكُمْ فَذُوقُوا مَا كُنْتُمْ تَكْنِزُونَ ﴿٣٥﴾**

---

**34)** (يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا إِنَّ كَثِيرًا مِنَ الْأَحْبَارِ وَالرُّهْبَانِ لَيَأْكُلُونَ أَمْوَالَ النَّاسِ بِالْبَاطِلِ) – **ey iman gətirənlər, həqiqətən, yəhudi və xristian alimlərinin və zahidlərinin çoxu xalqın mallarını* haqsız və rüşvət yoluyla alıb yeyərlər.** (وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللهِ) – **xalqın Allah-Təalanın ehkamına düz əməl etməsinə mane olub, öz nəfsani arzuları ilə Allah-Təalanın hökmlərini dəyişdirib, xalqa elə öyrədərlər.** (وَالَّذِينَ يَكْنِزُونَ الذَّهَبَ وَالْفِضَّةَ) – **o şəxslər ki dünya malını - qızıl və gümüşü xəzinə və anbarlarda yığıb saxlayırlar,**(وَلَا يُنْفِقُونَهَا فِي سَبِيلِ اللهِ) – **Allah-Təala yolunda, din və millət üçün zəruri olan yerlərdə sərf etmirlər,** (فَبَشِّرْهُمْ بِعَذَابٍ أَلِيمٍ) – (ey Məhəmməd), **o şəxsləri qiyamət günündə şiddətli əzabla müjdələ,** (bax gör ki, Allah-Təala sıradakı ayədə xəzinə toplayan varlılara nə vəd edir?)

*(****Qeyd:** Bu ayeyi-şərifə həqiqətdə biz İslam üləmalarına xitabdır. Yəni ey İslam üləması, siz də yəhudi və xristian üləmaları kimi olmayın, xalqdan rüşvət alıb pak şəriət ehkamını dəyişdirməyin. Heyhat, heyhat! Görəsən, islam üləması arasında belə şey olarmı? Onlar tamamən zahir və batinlərini gözəl, bəyənilən xüsusiyyətlər ilə bəzəyib süsləyiblər. Necə ola bilər ki, onlardan belə əməllər meydana gəlsin? Bəli, bütün islam alimlərinin iddiası budur. Amma həqiqət üzrə baxanda indi uca peyğəmbərimizin buyurduğu o vaxt gəlib. "Bir zaman gələr, mənim ümmətimdə Quranı oxumaqdan başqa bir şey qalmaz" hədisinin hökmü reallaşıb. Bu səhih hədis - möcüzəli bəyan o cənabın mübarək ağzından çıxıb, bizim bu zəmanəmiz şəriət sahibinin xəbər verdiyi o zamandır və Quranın sözünü deyənləri mülhid və zındıqlığa isnad edib, bununla belə özlərini Quran əhli sayırlar. (İlahi, ey acizlərə yardımçı olan, bizə də mərhəmət nəzəri ilə bax).*

**35)** (يَوْمَ يُحْمَى عَلَيْهَا فِي نَارِ جَهَنَّمَ) – **o gün ki** (qiyamət günü) **cəhənnəm odunda onların topladığı qızıl, gümüşləri qızdırılar.** (فَتُكْوَى بِهَا جِبَاهُهُمْ وَجُنُوبُهُمْ وَظُهُورُهُمْ) – **həmin isti olan qızıl, gümüşlə onların alınlarına, qabırğalarına və kürəklərinə dağ basılacaq.** (هَذَا مَا كَنَزْتُمْ لِأَنْفُسِكُمْ) – **onlara deyilər: "Bu həmin şeydir ki, öz mənfəətiniz üçün yığıb, Allah-Təalanın istədiyi yerdə sərf etmədiniz.** (فَذُوقُوا مَا كُنْتُمْ تَكْنِزُونَ) – **indi yığıb saxladığınız o şeyin əzabını dadın".**

*(****Qeyd:** Varlıların əksəriyyəti mallarının zəkatını (onda bir hissəsini) versələr, din yolunda sərf edilsə, islamda heç bir nöqsan qalmaz, əfsus və təəssüflər olsun ki, müsəlmanlar bu ayənin məzmunundan qafil olublar, amma digər dinlərə qulluq edən varlılar bu ayənin məzmununu özlərinə şüar edib, din və millət yolunda böyük məbləğlər sərf edirlər, bəs müsəlmanların zənginləri bu ayəni eşitməyiblər, yoxsa Qurani-Şərifə etiqadları yoxdur? Əgər etiqadları yoxdursa, niyə özlərinə müsəlman*

إِنَّ عِدَّةَ الشُّهُورِ عِنْدَ اللَّهِ اثْنَا عَشَرَ شَهْرًا فِي كِتَابِ اللَّهِ يَوْمَ خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ مِنْهَا أَرْبَعَةٌ حُرُمٌ ذَلِكَ الدِّينُ الْقَيِّمُ فَلَا تَظْلِمُوا فِيهِنَّ أَنْفُسَكُمْ وَقَاتِلُوا الْمُشْرِكِينَ كَافَّةً كَمَا يُقَاتِلُونَكُمْ كَافَّةً وَاعْلَمُوا أَنَّ اللَّهَ مَعَ الْمُتَّقِينَ ﴿٣٦﴾

---

*deyirlər? Qoy özlərini başqa bir dinə isnad etsinlər, vay olsun onlara, qiyamət günündə Allahın hüzurunda nə cavab verəcəklər? Varlı şəxslər öz insaflarına necə sığışdırırlar ki, millətin min cür ehtiyacı ola-ola, dünya malını yığıb xəzinə toplasınlar, millətin ən kiçik bir ehtiyacını da həll etməsinlər? Quran oxuyub namaz qılsa da, Quranı öpüb gözünün üstünə qoysa da, belə şəxs müsəlmandırmı və şərəfi vardırmı? Quranın ehtiramı ona əməl etməkdir, nəinki göz, baş üstə qoymaq. İbn Abbas deyir: "Hz. Peyğəmbərin hüzuruna bir qrup adam gəlib dedi: "Ey peyğəmbər, bizim aramızda tərki-dünya olan zahid bir şəxs var. Gecələr namaz qılıb gündüzlər oruc tutar və s." Onu xeyli təriflədilər. Hz. Peyğəmbər buyurdu: "Bəs sizin hər biriniz qazanc baxımından elə bir şəxsin xərcliyini verməyə qadirsinizmi?" Dedilər ki, "Bəli, qadirik". Hz. Peyğəmbər buyurdu: "Siz hamınız ondan yaxşısınız". Bu hədis buna işarədir ki, insan var-dövlət əldə edib, ümmətin övladlarına kömək etməlidir, amma tərki -dünya olub, bir parça murdar ət kimi xalqa ağır yük olmamalıdır, belə şəxsin islamda yeri olmayıb, onun ibadətindən də heç kimə bir fayda yoxdur. Əsl kişi odur ki, başqalarına xeyir versin, ancaq özünə mənfəət verib, sadəcə yeyib-içməyi düşünən şəxs heyvanlar kimidir).*

(Allah-Təala axirətin nemət və əzabını dünyada adət edilən şeylərlə xəbər verir ki, nemət və əzabın həqiqəti dərk olunsun. Necə ki bu ayədə dünya əməllərindən olan dağ vurulmaqla zənginlərə əzab vədi verilir. Müşriklər gah ayları 14 hesab edib, gah 4 hörmətli (haram) ayın yerinə ayrı ayları seçib, o ayın hörmətini pozub, o ayda savaşardılar, o xüsusda gələn ayə nazil oldu).

**36) (إِنَّ عِدَّةَ الشُّهُورِ عِنْدَ اللَّهِ اثْنَا عَشَرَ شَهْرًا فِي كِتَابِ اللَّهِ) – həqiqətən, Allah-Təala yanında ayların sayı hikmət üzrə 12-dir. (يَوْمَ خَلَقَ السَّمَاوَاتِ وَالْأَرْضَ) – Allah-Təala səmaları və yeri yaratdığı gündən** (belədir)**. (مِنْهَا أَرْبَعَةٌ حُرُمٌ) – o 12 aydan 4 ayda savaşmaq haramdır.** (Zülqədə, zülhiccə, məhərrəm, rəcəb)**, bu 4 ay hörmətli** (haram) **aylardır. (ذَلِكَ الدِّينُ الْقَيِّمُ) – bu** (4 ayın hörmətli (haram) olması) **möhkəm olan dindir.** (Bu qanun Hz. İbrahim və İsmayıldan qalan qanun idi ki, ərəblər ona əməl edirdilər, əgər o 4 ayda bir şəxs atasının, ya da oğlunun qatili ilə qarşılaşsaydı, ona heç bir əziyyət etməzdi. Bir qədər zamandan sonra o qanunu dəyişdirib, qeyd olunan ayların hörmətini (haramlığını) pozdular. Hz. Peyğəmbərin vaxtında yenidən bu qanun bərpa edildi). **(فَلَا تَظْلِمُوا فِيهِنَّ أَنْفُسَكُمْ) – o aylarda savaşmaqla özünüzə zülm etməyin. (وَقَاتِلُوا الْمُشْرِكِينَ كَافَّةً) – əgər o aylarda müşriklər sizinlə savaşıb, müharibəyə başlasalar, necə ki onların hamısı savaşa bir yerdə gəlir, siz də bir yerdə onlarla savaşmağa gedin. (كَمَا يُقَاتِلُونَكُمْ كَافَّةً وَاعْلَمُوا أَنَّ اللَّهَ مَعَ الْمُتَّقِينَ) – bilin ki, Allah-Təala müttəqilərlə bir yerdədir və onlara köməkçidir.** (Ərəblər hər zaman bir-

إِنَّمَا النَّسِيءُ زِيَادَةٌ فِي الْكُفْرِ يُضَلُّ بِهِ الَّذِينَ كَفَرُوا يُحِلُّونَهُ عَامًا وَيُحَرِّمُونَهُ عَامًا لِيُوَاطِئُوا عِدَّةَ مَا
حَرَّمَ اللَّهُ فَيُحِلُّوا مَا حَرَّمَ اللَّهُ زُيِّنَ لَهُمْ سُوءُ أَعْمَالِهِمْ وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ ﴿٣٧﴾ يَا أَيُّهَا
الَّذِينَ آَمَنُوا مَا لَكُمْ إِذَا قِيلَ لَكُمُ انْفِرُوا فِي سَبِيلِ اللَّهِ اثَّاقَلْتُمْ إِلَى الْأَرْضِ أَرَضِيتُمْ بِالْحَيَاةِ الدُّنْيَا مِنَ
الْآَخِرَةِ فَمَا مَتَاعُ الْحَيَاةِ الدُّنْيَا فِي الْآَخِرَةِ إِلَّا قَلِيلٌ ﴿٣٨﴾ إِلَّا تَنْفِرُوا يُعَذِّبْكُمْ عَذَابًا أَلِيمًا وَيَسْتَبْدِلْ
قَوْمًا غَيْرَكُمْ وَلَا تَضُرُّوهُ شَيْئًا وَاللَّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ﴿٣٩﴾

---

biriləri ilə savaşardılar, elə ki savaş zamanı haram (hörmətli) aylardan biri daxil olurdu, gərək savaşı tərk edəydilər, savaşı tərk etmək onlara ağır gəlirdi, o il o ayda savaşmağı halal edib onun əvəzinə başqa bir ayı haram edərdilər, o biri gələn ayda yenə o ayı haram edərdilər. Sıradakı ayə bu barədə nazil olub hökm edildi ki, gərək, o aylar öz hörmətində qalıb, heç vaxt dəyişdirilməsin).

**37) (إِنَّمَا النَّسِيءُ زِيَادَةٌ فِي الْكُفْرِ) – həqiqətən, haram olan ayları dəyişdirib, haramı halal etmək küfrü artırmaqdır. (يُضَلُّ بِهِ الَّذِينَ كَفَرُوا) – bu dəyişiklik səbəbinə kafir olan rəislər onlara tabe olanları zəlalətə salıb kafir edirlər. (يُحِلُّونَهُ عَامًا) – o hörmətli** (haram) **ayı bir il halal edib onun əvəzinə başqa ayları seçirsiniz. (وَيُحَرِّمُونَهُ عَامًا) – o biri ildə yenə o ayı haram edərlər. (لِيُوَاطِئُوا عِدَّةَ مَا حَرَّمَ اللَّهُ) – haram ayı halal edib onun əvəzinə başqa ayları haram edirlər ki, Allah-Təalanın haram etdiyi aylarla müvafiq olub 4 ay tamam olsun. (فَيُحِلُّوا مَا حَرَّمَ اللَّهُ) – özlərinin haram etdiyi ayların sayını müvafiq etmək üçün Allah-Təalanın haram etdiyini halal edirlər. (زُيِّنَ لَهُمْ سُوءُ أَعْمَالِهِمْ) – nəfsləri pis əməllərini onlara gözəl göstərdiyindən o pis əməlləri gözəl gördülər. (وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ) – Allah-Təala kafir olan camaatı haqq tərəfinə hidayət etməz.**

**38) (يَا أَيُّهَا الَّذِينَ آَمَنُوا مَا لَكُمْ إِذَا قِيلَ لَكُمُ انْفِرُوا فِي سَبِيلِ اللَّهِ اثَّاقَلْتُمْ إِلَى الْأَرْضِ ) – ey iman gətirənlər, sizə nə olubdur ki,** (Hz. Peyğəmbər deyir:) **köç edib Allah-Təala yolunda cihada gedin, deyiləndə, bu sözü eşidəndə üzərinizə ağırlıq çöküb, yerə oturub cihada getməyi xoşlamırsınız. (أَرَضِيتُمْ بِالْحَيَاةِ الدُّنْيَا مِنَ الْآَخِرَةِ) – axirət əvəzinə dünya həyatına razı olursunuz?** (Cihada getməkdə axirət savabı vardır, dünyadan ötrü axirəti tərk etmək olmaz)**. (فَمَا مَتَاعُ الْحَيَاةِ الدُّنْيَا فِي الْآَخِرَةِ إِلَّا قَلِيلٌ) – axirətin müqabilində dünya həyatının malı az olan bir şeydir.**

**39) (إِلَّا تَنْفِرُوا يُعَذِّبْكُمْ عَذَابًا أَلِيمًا) – əgər peyğəmbər sizə cihadı əmr edəndə ağır tərpənib getməsəniz, hər halda Allah-Təala sizə dünya və axirətdə şiddətli əzab edər. (وَيَسْتَبْدِلْ قَوْمًا غَيْرَكُمْ) – sizin əvəzinizə başqa bir camaatı** (itaət edənləri) **gətirib, hamınızı həlak edər. (وَلَا تَضُرُّوهُ شَيْئًا) – Allah-Təalaya heç bir zərər yetirə bilməzsiniz. (وَاللَّهُ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ) – Allah-Təala hər bir şeyə qadirdir. Bundan sonra gələn ayədə hicrət əhvalatına işarə olunur. O**

**səbəbdən hicrət əhvalatı burada ixtisarla qeyd olunur. Belə ki bu kitaba baxanlar mətləbdən xəbərdar ola bilsinlər:** (elə ki Hz. Peyğəmbər Məkkədə gecə vaxtı Hz. Əlini öz yatağında qoyub, evindən getdi, (bu mətləb Ənfal surəsinin 28-ci ayəsindən sonra qeyd olunubdur, oraya baxılsın) özü Əbu Bəkirin evinə getdi. Əbu Bəkir dedi: "Ey Peyğəmbər, nə olubdur?" Buyurdu ki, "Hicrətə əmr olunmuşam". Əbu Bəkir dedi: "Ey Peyğəmbər, mən sənin xidmətindəyəm, iki yaxşı, gözəl dəvəm var, birinə sən minərsən". Həzrət buyurdu: "Qiyməti nə isə, elə qəbul edərəm". Hər ikisi Məkkədən çıxıb, * Sevr dağında olan bir mağaraya daxil olub gizləndilər.

*(****Qeyd:*** *Məkkədə üzü cənuba duranda Sevr dağı Məkkənin sağ tərəfində olub, Məkkədən o dağdakı mağaraya bir saatlıq yoldur).*

Qüreyş camaatı onları tutmaq üçün arxalarınca gəldilər, xeyli axtarışdan sonra gəlib mağaranın üstündə dayandılar. Hər tərəfi axtarsalar da, Allah-Təala onların gözlərini kor edib mağaraya baxmadılar. Əbu Bəkiri qorxu bürüyüb dedi: "Ey Peyğəmbər, əgər müşriklər ayaq tərəfdən baxsalar, bizi görərlər," Hz. Peyğəmbər buyurdu ki, qəmgin olma, Allah-Təala bizə köməkçidir. Müşriklər məyus olub Məkkəyə qayıtdılar. Hz. Peyğəmbər 3 gecə o mağarada qaldı, Əbu Bəkrin oğlu Abdullah gecələr gəlib onların yanında mağarada qalırdı. Sübh tezdən durub Məkkəyə qayıdırdı. Gündüz Məkkədə olub, eşitdiyi hər bir xəbəri gecə gəlib peyğəmbərə nəql edirdi. Amir ibn Füheyrə (Əbu Bəkirin qulamı) gecə yarıdan keçəndən sonra Əbu Bəkirin qoyunlarını götürüb orada saxlayardı. Hz. Peyğəmbər və Əbu Bəkir o qoyunların südündən içərdilər, 3 gecədən sonra Hz. Peyğəmbər bəni-əd-Düəli camaatından Mədinə yoluna yaxşı agah olan bir bələdçi tutdu. O şəxs müşrik idi. Dəvələri ona verdilər ki, 3-cü gün sübh tezdən orada hazır olsun. Tam vaxtında Düəli gəldi. Dəvələrə minib Mədinəyə yönəldilər. Amir ibn Füheyrə (Əbu Bəkirin qulamı) də onlarla birlikdə olub, Düəlinin rəhbərliyində dəniz tərəfindən yola düşdülər. Qüreyş camaatı elə ki Hz. Peyğəmbəri tapmaqdan ümidini kəsdi, ərəb qəbilələrinə elan etdilər ki, kim Məhəmmədi və Əbu Bəkiri diri, ya da ölü gətirsə, onların diyətini o şəxsə verəcəyik. Bəni-Müdlic qəbiləsinin rəisi olan Süraqə ibn Malik adlı şəxs qəbilədə, öz qövmünün arasında məclisdə oturmuşdu. Bir kişi gəlib ona dedi ki, "Ey Süraqə, dəniz kənarı ilə gedən bir neçə nəfər gördüm, zənn edirəm ki, onlar Məhəmməd və yoldaşlarıdır". Süraqə deyir: "Mən bildim ki, o şəxsin dediyi adamlar Məhəmməd və onun yoldaşlarıdır, amma bilinməsini istəmədim". Dedim: "Onlar deyil, bəlkə də başqa şəxslərdirlər, buradan keçdilər, dəvə axtarırdılar". Süraqə deyir: "Bir qədər gözləyəndən sonra evimə gedib kənizə dedim ki, mənim atımı apar filan dərədə saxla. Özüm zireh geyinib, nizəmi götürüb gizlin yola çıxdım ki, heç kim xəbərdar olub bu qənimətdə mənə şərik olmasın. Gəlib ata minib, az bir vaxtda onlara çatdım. Qəfildən at üzü üstə yıxılıb, mən də yerə düşdüm. Ayağa durdum, istədim fala baxım görüm, bunların dalınca getmək yaxşıdır, yoxsa yox? Fal ağaclarını götürdüm. Fal açdım, pis gəldi, fala tabe

olmayıb, ata minib, onların dalınca getdim, yaxınlaşanda peyğəmbərin səsini eşitdim, ətrafa baxmadan Quran oxuyurdu. Amma Əbu Bəkir ətrafa və arxaya çox baxırdı. Bu zaman yenə atım üzüüstə yerə yıxıldı. Mən də üzüüstə yerə gəldim. Çətinliklə ayağa durub yenə fal açdım. Yenə pis gəldi, səsləndim: "Ey Peyğəmbər, amandasınız, məndən sizə bir zərər gəlməz". Hz. Peyğəmbər dayandı. Gəlib onlara yetişdim. Hələ onlara çatmamış qəlbimə agah oldu ki, o, Qüreyşə qalib gəlib, dinini yayacaqdır. Elə ki ona çatdım, dedim: "Ey Peyğəmbər, Qüreyş elan edibdir ki, kim sizi qətlə yetirsə, ya da sağ tutub gətirsə, sizin diyətinizi ona verəcəklər, amma mən bundan vaz keçdim. Xahiş edirəm ki, mənə bir aman kağızı verəsiniz ki, Qüreyşə qalib gəldiyinizdə, mən amanda olum". Hz. Peyğəmbər buyurdu. Amir ibn Füheyrə ondan ötrü bir parça dərinin üstündə yazıb ona verdi. Ondan sonra Hz. Peyğəmbər gedib yolda Şamdan bir qafilə ilə ticarətdən qayıdan əmisi oğlu Zübeyr ibnül-Əvvamla qarşılaşdı. Zübeyr iki dəst ağ libas, birini peyğəmbərə, o birini də Əbu Bəkirə geydirdi. O biri tərəfdən Mədinə əhli Hz. Peyğəmbərin Məkkədən çıxdığını eşidib hər gün sübh tezdən Mədinənin ətrafına çıxıb, Hz. Peyğəmbərin gəlməsini gözləyirdi. Bir gündən sonra Hz. Peyğəmbər və yoldaşları günortaya yaxın günün dəhşətli istisində Mədinəyə çatdılar. Bir nəfər yəhudi qalanın üstünə çıxıb baxırdı, qəfildən Hz. Peyğəmbəri gördü, uzaqdan ağ libasla özü və yoldaşları tamam suyun içində gəlirdilər. Mədinə əhlinə car çəkdi ki, budur peyğəmbər gəlir. Mədinə əhli dəstə-dəstə Hz. Peyğəmbərin görüşünə gəldilər. Hz. Peyğəmbər gəlib Mədinədən kənarda Bəni-Əmr və ibn Əvf məhəlləsində (Qubada) dayandılar. Hz. Peyğəmbər sakitcə oturdu. Xalqla salamlaşmaq üçün ayağa durdu. Hz. Peyğəmbəri görməyən şəxslər Əbu Bəkiri peyğəmbər zənn edib, ona – xoş gəlmisən, - deyirdilər. Hz. Peyğəmbərin dayandığı yer kölgəlik idi, elə ki ora gün düşdü, Əbu Bəkir ondan ötrü əbasını kölgəlik etdi, ancaq o zaman insanlar Hz. Peyğəmbəri tanıdılar. Hz. Peyğəmbər o məkanda – Qubada məscid tikdi. İslamda ilk tikilən məsciddir. İslam şəriətinin sahibi öz müqəddəs əliylə (ruhumuz ona fəda olsun) o məscidin əsasını qoydu. 20 günə qədər orada qalıb, həmin məsciddə namaz qılıb, ondan sonra Mədinəyə daxil oldu. Hz. Peyğəmbərin dəvəsi gəlib (indi məscid olan yerdə) oturdu. Hz. Peyğəmbər o yerin sahiblərini (iki nəfər cavanı) çağırıb onlardan o yeri məsciddən ötrü istədi. Onlar dedilər: "Ey Peyğəmbər, bu yeri sənə bağışladıq". Hz. Peyğəmbər qəbul etmədi, qiyməti ilə o yeri alıb məscid tikdi. Mədinə məscidi islamda tikilən ikinci məsciddir. Hz. Peyğəmbər özü ora palçıq daşıdı. Bu əhvalatlara növbəti ayələrdə işarə olunur).

**40) (إِلَّا تَنْصُرُوهُ فَقَدْ نَصَرَهُ اللَّهُ) – əgər siz peyğəmbərə kömək etməsəniz də, həqiqətən, Allah-Təala ona kömək etdi. (إِذْ أَخْرَجَهُ الَّذِينَ كَفَرُوا ثَانِيَ اثْنَيْنِ) – kafirlər onu Məkkədən çıxardıqlarında, o, iki nəfərin biri idi, (bir özü, o biri də**

**إِذْ هُمَا فِي الْغَارِ إِذْ يَقُولُ لِصَاحِبِهِ لَا تَحْزَنْ إِنَّ اللَّهَ مَعَنَا فَأَنْزَلَ اللَّهُ سَكِينَتَهُ عَلَيْهِ وَأَيَّدَهُ بِجُنُودٍ لَمْ تَرَوْهَا وَجَعَلَ كَلِمَةَ الَّذِينَ كَفَرُوا السُّفْلَى وَكَلِمَةُ اللَّهِ هِيَ الْعُلْيَا وَاللَّهُ عَزِيزٌ حَكِيمٌ ﴿٤٠﴾ انْفِرُوا خِفَافًا وَثِقَالًا**

---

**Əbu Bəkir), (إِذْ هُمَا فِي الْغَارِ) – o zaman ki hər ikisi mağarada idi, (إِذْ يَقُولُ لِصَاحِبِهِ لَا تَحْزَنْ إِنَّ اللَّهَ مَعَنَا) – Əbu Bəkiri qorxu bürüyəndə, peyğəmbər ona buyurdu: "Qəmgin olub müşriklərdən qorxma, Allah-Təala bizə köməkçidir,** (bu neçə vaxtda Allah-Təala öz peyğəmbərinə kömək etdi, halbuki onun heç bir köməkçisi yox idi), **(فَأَنْزَلَ اللَّهُ سَكِينَتَهُ عَلَيْهِ) – Allah-Təala peyğəmbərinə vüqar və təmkin verib, qəlbi aram olub, qorxu onun qəlbinə daxil olmadı, (وَأَيَّدَهُ بِجُنُودٍ لَمْ تَرَوْهَا) – əsla görmədiyiniz bir qoşun ilə** (ruhani qüvvələrlə) **peyğəmbərinə kömək etdi. (وَجَعَلَ كَلِمَةَ الَّذِينَ كَفَرُوا السُّفْلَى) – müşriklərin küfrə dəvətini alçaldıb, zəlil etmişdi, (وَكَلِمَةُ اللَّهِ هِيَ الْعُلْيَا) – Allah-Təalanın sözü - islama dəvət etməsi bütün sözlərdən ucadır. İslam şirkə qalib olacaqdır. (وَاللَّهُ عَزِيزٌ حَكِيمٌ) – Allah-Təala məxluqata qalib və hər bir əməli hikmət üzrədir.**

**41) (انْفِرُوا خِفَافًا وَثِقَالًا) – ey müsəlmanlar, Allah-Təala yolunda cihad* etməyə gedin.**

*(***Qeyd:** *Allah-Təala cihad etməyi nə qədər təşviq edir. Cihad etmək sadəcə qılınc çalmaqla savaşmaqdan ibarət deyildir. Din yolunda savaşmağın ən üstünü var-dövlət ilə olandır. Necə ki əvvəlki ayələrdə dəfələrlə bu mətləbə işarə olunubdur. Bəs baxmırsınız ki, Allah-Təala var-dövlətlə cihad etməyi, bu yolda mal xərcləməyi necə əmr edir? Elə cihad var ki, mal ilə olar, can verməklə olmaz. Din və məzhəbə tərəqqi verən şey zənginlərin bu yolda mal sərf edib, ümmətin ehtiyaclarını həll etməkdir, din yolunda bu cür var-dövlət xərcləyən ilk şəxs Hz. Peyğəmbərin ilk xanımı Hz. Xədicə olubdur. Ondan sonra səhabələrin bəzisi bütün var-dövlətini, bəzisi malının yarısını, bəziləri də öz imkanlarına görə din yolunda var-dövlətlərini xərcləyiblər. Təbük savaşı çox çətin bir savaş olubdur, o savaşın bütün tədarükünü Osman ibn Əffan görmüşdür. Əgər islamın tarixinin ilk dövrünə agah olsan, görərsən ki, hər bir zamanda sultanlar və zənginlər vətən övladlarını yetişdirməkdən ötrü xeyli məbləğlər sərf ediblər. Çox təəccüblüdür, onlarla müqayisədə məlum olur ki, indi dünyada islamın ancaq adı qalıb, bizim zəmanəmizdə olan zənginlər mal toplamağı özlərinə şüar edib, xəzinələri doldurub saxlamaqdan başqa, heç bir şey bilmirlər. Nə qədər malları artsa, bir o qədər də xəsislikləri artar. Misir tarixini araşdıran şəxslər müsəlmanların din və millət yolunda necə canfəşanlıq etdiyini görə bilərlər. Fatimi xəlifələrindən əl-Müstənsir Billah zamanında Misirdə olan kitabxanalarda 300 min cild kitab var idi. Halbuki o dövrdə hələ kitab nəşr işi meydana gəlməmişdi. Bu kitablarla müqayisədə orada olan məktəb və mədrəsələrin, tələbələrin sayını siz düşünün. Habelə digər sultanların zamanında olan elmi müəssisələrə bir baxın, o cümlədən Misir sultanı Əhməd ibn Tolunun əmri ilə tikilən xəstəxanalarda həkimlər xəstələrə pulsuz qulluq edirdi. Bu dövrdə olan tərəqqi, mədrəsələr, məscidlər, rəsədxanalar başqa heç bir millətdə yox idi. İndiki dövrdə isə başqa millətlər müsəlmanlara həqarətlə baxırlar. İslamın zəifləməsinin səbəbi məzhəb ixtilafı, bir də varlıların xəsisliyidir. Fərdləri an-*

وَجَاهِدُوا بِأَمْوَالِكُمْ وَأَنْفُسِكُمْ فِي سَبِيلِ اللّٰهِ ذَلِكُمْ خَيْرٌ لَكُمْ إِنْ كُنْتُمْ تَعْلَمُونَ ﴿٤١﴾ لَوْ كَانَ عَرَضًا
قَرِيبًا وَسَفَرًا قَاصِدًا لَاتَّبَعُوكَ وَلَكِنْ بَعُدَتْ عَلَيْهِمُ الشُّقَّةُ وَسَيَحْلِفُونَ بِاللّٰهِ لَوِ اسْتَطَعْنَا لَخَرَجْنَا مَعَكُمْ
يُهْلِكُونَ أَنْفُسَهُمْ وَاللّٰهُ يَعْلَمُ إِنَّهُمْ لَكَاذِبُونَ ﴿٤٢﴾

---

*caq öz şəxsi mənfəətini düşünən bir millət heç vaxt tərəqqi edib, mədəniyyət aləminə daxil ola bilməz, gərək, gecə-gündüz oturub, özümüzə ağlayaq).*

**Cihada rəğbətiniz olub cihad etmək sizin üçün yüngül olsa, ya da rəğbətiniz olmayıb cihad etmək sizin üçün ağır olsa, hər iki halda da gərək, cihada gedəsiniz. (**وَجَاهِدُوا بِأَمْوَالِكُمْ وَأَنْفُسِكُمْ فِي سَبِيلِ اللّٰهِ**) – Allah-Təala yolunda malınız və nəfsinizlə cihad edin. (**ذَلِكُمْ خَيْرٌ لَكُمْ إِنْ كُنْتُمْ تَعْلَمُونَ**) – əgər cihadın mənfəətinə agah olsanız, bu cihad etmək sizin üçün daha yaxşıdır. Cihadda həm dünya, həm də axirət mənfəəti vardır.** (Bundan sonra gələn ayələrdə Təbük savaşı əhvalatına işarə olunur. Təbük bir yerin adıdır. Şam mülkündən olan Təbük əhli onlarla qonşu olan müsəlmanlara əziyyət edirdilər və bu səbəbdən Hz. Peyğəmbər onlarla cihad etməyi əmr etdi. Bu cihad havanın son dərəcə isti olduğu yay fəslində vaqe oldu. Mədinə əhlinin həyat şəraiti çətin idi. O səbəbdən bu savaşa getməyə istəksiz idilər. Bu savaşa hazırlıq üçün fədakar zəngin müsəlmanların bəzisi bütün var-dövlətini, bəzisi də var-dövlətinin yarısını sərf etdi. Mədinə əhlindən bəzisi isə savaşa getməmək üçün yalandan bəhanələr gətirdilər. Hz. Peyğəmbərin özü o qoşunla Təbükə gedib, orada Şam ordusunu görmədilər. (Şam qoşunu islam qoşununun gəldiyini eşitdikdə, oranı boşaldıb getmişdilər). Müsəlmanlar oradan sağ-salamat qayıdıb Mədinəyə gəldilər. Bu savaşdan geri qalanları Allah-Təala məzəmmət edib, onları münafiq adlandırır).

**42) (**لَوْ كَانَ عَرَضًا قَرِيبًا وَسَفَرًا قَاصِدًا لَاتَّبَعُوكَ**)** – (ey Məhəmməd)**, bu müsəlmanlar Təbük savaşına getməkdə ağır tərpənirlər, əgər asan və zəhmətsiz bir mənfəət olsaydı və ya orta** (mənzilli) **bir səfər olub, çox məşəqqətli və uzaq olmasaydı, o vaxt sənə tabe olardılar. (**وَلَكِنْ بَعُدَتْ عَلَيْهِمُ الشُّقَّةُ**) – amma bu Təbük səfəri onlardan ötrü məşəqqətli bir səfər olub, o səbəbdən sənə tabe olmayıb, səndən geri qalıb, Mədinədə qaldılar.** (Hz. Peyğəmbər Təbük savaşından gələndən sonra savaşdan geri qalanlar gəlib Hz. Peyğəmbərdən üzr istəyib, yalandan and içdilər. Allah-Təala onları təkzib edib üzrxahlıqlarını rədd edir)**. (**وَسَيَحْلِفُونَ بِاللّٰهِ لَوِ اسْتَطَعْنَا لَخَرَجْنَا مَعَكُمْ**) – Allah-Təalaya and içib deyirlər ki, sizinlə getməyə qadir olmadıq, əgər qüdrətimiz olub bizdən ötrü mümkün olsaydı, hər halda sizinlə birlikdə Təbük savaşına çıxardıq. (**يُهْلِكُونَ أَنْفُسَهُمْ**) – yalandan and içməklə özlərini həlak edirlər. (**وَاللّٰهُ يَعْلَمُ إِنَّهُمْ لَكَاذِبُونَ**) – Allah-Təala onların yalandan and içib yalan dediyinə agahdır. Onların savaşa getmələri mümkün idi. Özləri getmədilər.** (Savaşa getmək vaxtı gələndə bəzisi gəlib Mədinədə qalmaq üçün Hz. Peyğəmbərdən izin

عَفَا اللَّهُ عَنْكَ لِمَ أَذِنْتَ لَهُمْ حَتَّى يَتَبَيَّنَ لَكَ الَّذِينَ صَدَقُوا وَتَعْلَمَ الْكَاذِبِينَ ﴿٤٣﴾ لَا يَسْتَأْذِنُكَ
الَّذِينَ يُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ أَنْ يُجَاهِدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ وَاللَّهُ عَلِيمٌ بِالْمُتَّقِينَ ﴿٤٤﴾ إِنَّمَا
يَسْتَأْذِنُكَ الَّذِينَ لَا يُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَارْتَابَتْ قُلُوبُهُمْ فَهُمْ فِي رَيْبِهِمْ يَتَرَدَّدُونَ ﴿٤٥﴾ وَلَوْ
أَرَادُوا الْخُرُوجَ لَأَعَدُّوا لَهُ عُدَّةً وَلَكِنْ كَرِهَ اللَّهُ انْبِعَاثَهُمْ فَثَبَّطَهُمْ وَقِيلَ اقْعُدُوا مَعَ الْقَاعِدِينَ ﴿٤٦﴾

---

istəyib, üzrxahlıq etdilər ki, getməmiz mümkün deyil, Hz. Peyğəmbər də onlara izin verdi, növbəti ayədə onlara izin verdiyi üçün Allah-Təala peyğəmbəri məzəmmət edir).

**43) (عَفَا اللَّهُ عَنْكَ لِمَ أَذِنْتَ لَهُمْ)** – (ey Məhəmməd)**, Allah-Təala səni bağışladı, niyə savaşa getməmək üçün üzrxahlıq edib, səndən izin istəyənlərə icazə verdin? (حَتَّى يَتَبَيَّنَ لَكَ الَّذِينَ صَدَقُوا وَتَعْلَمَ الْكَاذِبِينَ) – sən, gərək, doğru deyənlər aşkar olub yalan deyənlərə agah olana qədər onlara izin verməyəydin. Ondan sonra doğru deyənlərə izin verib, yalan deyənlərə verməyəydin.**

**44) (لَا يَسْتَأْذِنُكَ الَّذِينَ يُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ أَنْ يُجَاهِدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ)** – (ey Məhəmməd)**, o şəxslər ki Allah-Təalaya və axirət gününə iman gətiriblər, cihada getməmək üçün səndən izin istəməzlər, bəlkə, mal və canları ilə cihadı seçib, cihad edərlər. (وَاللَّهُ عَلِيمٌ بِالْمُتَّقِينَ) – Allah-Təala müttəqi şəxslərə -** (hansı ki Mədinədə qalmaq üçün səndən izin istəməzlər)**, agahdır.**

**45) (إِنَّمَا يَسْتَأْذِنُكَ الَّذِينَ لَا يُؤْمِنُونَ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ)** – (ey Məhəmməd)**, həqiqətən, Allah-Təalaya və axirət gününə iman gətirməyən şəxslər savaşdan geri qalmaq üçün səndən izin istəyirlər.** (Hz. Peyğəmbərdən izin alıb Mədinədə qalan, Təbük savaşına getməyən 39 nəfər idi). **(وَارْتَابَتْ قُلُوبُهُمْ) – iman gətirməkdə onların qəlbləri şəkk içində olub, (فَهُمْ فِي رَيْبِهِمْ يَتَرَدَّدُونَ) – şübhələrində çaşqın və sərgərdan qalıblar, nə imanları məlumdur, nə küfrləri,** (belələrinə münafiq deyilir)**.**

**46) (وَلَوْ أَرَادُوا الْخُرُوجَ لَأَعَدُّوا لَهُ عُدَّةً) – əgər bu münafiqlər savaşa getmək istəsəydilər, hər halda ondan ötrü hazırlıq görə bilərdilər.** (Yəni savaşa hazırlaşmağa imkanları var idi, bəziləri üzrxahlıq etdi ki, bizim hazırlığımız yoxdur, yalan dedilər). **(وَلَكِنْ كَرِهَ اللَّهُ انْبِعَاثَهُمْ) – onlar ki savaşa getməmək üçün üzrxahlıq etdilər, Allah-Təala da onların nifaqına görə savaşa getmələrini istəmədi. (فَثَبَّطَهُمْ) – onları cihadı tərk etməkdə daha da sabit etdi. Çünki onların savaşa getmələri ilə müsəlmanlara zərər gələrdi. (وَقِيلَ اقْعُدُوا مَعَ الْقَاعِدِينَ) – şeytan vəsvəsə edib onlara əmr etdi ki, savaşa getməyib, Mədinədə oturanlarla birlikdə oturun.** (Qadınlarla, uşaqlarla, həqiqətən, üzrxahlığı olanlarla birlikdə oturun, bu, özünü zəif şəxslərə bərabər tutan qüvvətli və qüdrətli şəxslərə bir məzəmmətdir).

لَوْ خَرَجُوا فِيكُمْ مَا زَادُوكُمْ إِلَّا خَبَالًا وَلَأَوْضَعُوا خِلَالَكُمْ يَبْغُونَكُمُ الْفِتْنَةَ وَفِيكُمْ سَمَّاعُونَ لَهُمْ وَاللَّهُ عَلِيمٌ بِالظَّالِمِينَ ﴿٤٧﴾ لَقَدِ ابْتَغَوُا الْفِتْنَةَ مِنْ قَبْلُ وَقَلَّبُوا لَكَ الْأُمُورَ حَتَّى جَاءَ الْحَقُّ وَظَهَرَ أَمْرُ اللَّهِ وَهُمْ كَارِهُونَ ﴿٤٨﴾ وَمِنْهُمْ مَنْ يَقُولُ ائْذَنْ لِي وَلَا تَفْتِنِّي أَلَا فِي الْفِتْنَةِ سَقَطُوا وَإِنَّ جَهَنَّمَ لَمُحِيطَةٌ بِالْكَافِرِينَ ﴿٤٩﴾

---

**47) (لَوْ خَرَجُوا فِيكُمْ مَا زَادُوكُمْ إِلَّا خَبَالًا)** – (ey möminlər), **əgər bu münafiqlər sizinlə birlikdə cihada çıxsaydılar, sizin üçün şər və fəsaddan başqa, bir şey artırmazdılar. (وَلَأَوْضَعُوا خِلَالَكُمْ) – səy edib sürətlə sizin aranızda dolanıb söz gəzdirərdilər ki, aranıza fəsad salsınlar. (يَبْغُونَكُمُ الْفِتْنَةَ) – aranıza fəsad salıb cihad əməlinizi batil etmək üçün fitnə və fəsad axtarardılar. (وَفِيكُمْ سَمَّاعُونَ لَهُمْ) – siz möminlərin arasında sözlərinizi yığıb, gedib münafiqlərə xəbər verib fəsad salan şəxslər olardı.** (Möminlər münafiqləri tanımayıb, sirlərini aşkar etməyib, hər kəsdən çəkinsinlər deyə Allah-Təala münafiqlərin adlarını xəbər vermədi). **(وَاللَّهُ عَلِيمٌ بِالظَّالِمِينَ) – Allah-Təala zalım şəxslərdən** (münafiqlərə) **agahdır.**

**48) (لَقَدِ ابْتَغَوُا الْفِتْنَةَ مِنْ قَبْلُ ) – fitnə və fəsad axtarmaq münafiqlərin adətidir. Həqiqətən, bundan əvvəl də fitnə, fəsad axtarırdılar. (Uhud savaşında münafiq Abdullah ibn Übey öz camaatıyla savaşdan Mədinəyə qayıdıb bu fikirdə oldular ki, bir fəsad törədib, peyğəmbərə zərər vursunlar). (وَقَلَّبُوا لَكَ الْأُمُورَ)** – (ey Məhəmməd)**, bu münafiqlər səndən ötrü məkr və hiylələr etdilər ki, bəlkə, sənin işini batil etsinlər. (حَتَّى جَاءَ الْحَقُّ وَظَهَرَ أَمْرُ اللَّهِ) – belə ki, haqq** (Allah-Təalanın yardımı) **gəlib, Allah-Təalanın dini və şəriəti aşkar oldu. (وَهُمْ كَارِهُونَ) – münafiqlər Allah-Təalanın dininin aşkar olmasını istəməsə də.**

**49) (وَمِنْهُمْ مَنْ يَقُولُ ائْذَنْ لِي وَلَا تَفْتِنِّي)** – (ey Məhəmməd) **, münafiqlərdən bəzi şəxslər vardır ki, gəlib sənə deyirlər: "Mənə izin ver (ki, Mədinədə qalım. Məni Təbük savaşına aparıb) fitnəyə salma," (mən orda Rum qadınlarını görüb səbir edə bilmərəm. Bu sözü deyən münafiqlərdən Cədd ibn Qeys idi. Belə demişdi: "Ey Peyğəmbər, mən qadınları sevən bir kişiyəm, əgər mən bu savaşa getsəm, orada rum qızlarını görüb özümü saxlaya bilmərəm. Mənə izin ver, Mədinədə qalım". Allah-Təala belə şəxslərin cavabında buyurur:) (أَلَا فِي الْفِتْنَةِ سَقَطُوا)** – (ey Məhəmməd), **xəbərdar ol ki, bu sözü deyən şəxslər fitnəyə düşüblər, savaşa getməkdə fitnə yoxdur. Fitnə səndən geridə, Mədinədə qalmaqdır. (وَإِنَّ جَهَنَّمَ لَمُحِيطَةٌ بِالْكَافِرِينَ) –həqiqətən, cəhənnəm bu kafir olan münafiqləri əhatə edib, sanki, indi cəhənnəmin ortasındadırlar.**

إِنْ تُصِبْكَ حَسَنَةٌ تَسُؤْهُمْ وَإِنْ تُصِبْكَ مُصِيبَةٌ يَقُولُوا قَدْ أَخَذْنَا أَمْرَنَا مِنْ قَبْلُ وَيَتَوَلَّوْا وَهُمْ فَرِحُونَ ﴿٥٠﴾
قُلْ لَنْ يُصِيبَنَا إِلَّا مَا كَتَبَ اللَّهُ لَنَا هُوَ مَوْلَانَا وَعَلَى اللَّهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ ﴿٥١﴾ قُلْ هَلْ تَرَبَّصُونَ بِنَا
إِلَّا إِحْدَى الْحُسْنَيَيْنِ وَنَحْنُ نَتَرَبَّصُ بِكُمْ أَنْ يُصِيبَكُمُ اللَّهُ بِعَذَابٍ مِنْ عِنْدِهِ أَوْ بِأَيْدِينَا فَتَرَبَّصُوا إِنَّا مَعَكُمْ
مُتَرَبِّصُونَ ﴿٥٢﴾ قُلْ أَنْفِقُوا طَوْعًا أَوْ كَرْهًا لَنْ يُتَقَبَّلَ مِنْكُمْ إِنَّكُمْ كُنْتُمْ قَوْمًا فَاسِقِينَ ﴿٥٣﴾

---

**50) (إِنْ تُصِبْكَ حَسَنَةٌ)** – (ey Məhəmməd), **əgər bəzi savaşlarda sənə qənimət və düşmənə qalib olmaq nəsib olsa, (تَسُؤْهُمْ) – münafiqləri qəmgin edər. (وَإِنْ تُصِبْكَ مُصِيبَةٌ يَقُولُوا قَدْ أَخَذْنَا أَمْرَنَا مِنْ قَبْلُ) – əgər sənə bir müsibət üz versə, düşmən sənə qalib olsa, o vaxt münafiqlər deyərlər: “Həqiqətən, nə yaxşı ki, biz bundan əvvəl tədbirimizi görüb, savaşa getmədik, yoxsa bizə də bu zərər dəyərdi”. (وَيَتَوَلَّوْا وَهُمْ فَرِحُونَ) – ondan sonra sənin məğlub olmana şad olaraq, dönüb gedərlər.**

**51) (قُلْ لَنْ يُصِيبَنَا إِلَّا مَا كَتَبَ اللَّهُ لَنَا)** – (ey Məhəmməd), **de ki, Allah-Təalanın bizdən ötrü yazıb təyin etdiyindən başqa bizə heç bir bəla və müsibət yetişməz, ancaq Allah-Təalanın verdiyi hökmdən xilas olmaq olmaz. (هُوَ مَوْلَانَا) – hər bir işimizə hakim olan Allah-Təaladır. Onu özümüzə dost edib, başqasını dost tutmarıq. (və aləllahi fəlyətəvəkkəlil- mütəvəkkilun) (وَعَلَى اللَّهِ فَلْيَتَوَكَّلِ الْمُؤْمِنُونَ) – mömin şəxslər, gərək, hər bir işlərində Allah-Təalaya təvəkkül etsinlər.**

**52) (قُلْ هَلْ تَرَبَّصُونَ بِنَا إِلَّا إِحْدَى الْحُسْنَيَيْنِ)** – (ey Məhəmməd), **bu münafiqlərə de ki, biz cihada gedəndə gözləyirsiniz ki, məğlub olma xəbərimiz sizə yetişsin? Bizdən bunu gözləməyin. Bizdən sizə iki gözəl şeydən biri, ya düşmənə qalib olub qənimət götürmək, ya da şəhid olub axirət mükafatını qazanmaq xəbərindən başqası yetişməz. Bizdən sizə bu iki yaxşı xəbərin biri yetişəcəkdir.** (Siz xəyal edirsiniz ki, bizim cihadda öldürülməkdən xoşumuz gəlmir. O səbəbdən bizim məğlub olmağımıza şad olursunuz. Bizdən ötrü öldürülməklə sağ qalmaq arasında heç bir fərq yoxdur). **(وَنَحْنُ نَتَرَبَّصُ بِكُمْ أَنْ يُصِيبَكُمُ اللَّهُ بِعَذَابٍ مِنْ عِنْدِهِ أَوْ بِأَيْدِينَا) – amma biz gözləyirik ki, siz münafiqlərə iki pis şeydən biri yetişsin. Ya Allah-Təala öz yanından sizə bir əzab göndərib sizi həlak etsin, ya da bizim əlimizlə sizə əzab etsin. Hamınız bizim əlimizdə öldürüləcəksiniz. (فَتَرَبَّصُوا إِنَّا مَعَكُمْ مُتَرَبِّصُونَ)** – (ey münafiqlər), **siz bizim işimizin sonunu gözləyin, biz də sizinlə birlikdə sizin işinizin sonunu gözləyək. Görək Allah-Təala sizi necə zəlil edib öz dinini ucaldır?**

**53) (قُلْ أَنْفِقُوا طَوْعًا أَوْ كَرْهًا لَنْ يُتَقَبَّلَ مِنْكُمْ)** – (ey Məhəmməd), **de ki, ey münafiqlər, əgər Allah-Təala yolunda öz xoşunuzla, ya da zorla və naəlaclıqdan ehsan etsəniz, heç vaxt sizdən qəbul olunmayacaqdır. (إِنَّكُمْ كُنْتُمْ قَوْمًا فَاسِقِينَ)**

وَمَا مَنَعَهُمْ أَنْ تُقْبَلَ مِنْهُمْ نَفَقَاتُهُمْ إِلَّا أَنَّهُمْ كَفَرُوا بِاللَّهِ وَبِرَسُولِهِ وَلَا يَأْتُونَ الصَّلَاةَ إِلَّا وَهُمْ كُسَالَى وَلَا يُنْفِقُونَ إِلَّا وَهُمْ كَارِهُونَ ﴿٥٤﴾ فَلَا تُعْجِبْكَ أَمْوَالُهُمْ وَلَا أَوْلَادُهُمْ إِنَّمَا يُرِيدُ اللَّهُ لِيُعَذِّبَهُمْ بِهَا فِي الْحَيَاةِ الدُّنْيَا وَتَزْهَقَ أَنْفُسُهُمْ وَهُمْ كَافِرُونَ ﴿٥٥﴾ وَيَحْلِفُونَ بِاللَّهِ إِنَّهُمْ لَمِنْكُمْ وَمَا هُمْ مِنْكُمْ وَلَكِنَّهُمْ قَوْمٌ يَفْرَقُونَ ﴿٥٦﴾ لَوْ يَجِدُونَ مَلْجَأً أَوْ مَغَارَاتٍ أَوْ مُدَّخَلًا لَوَلَّوْا إِلَيْهِ وَهُمْ يَجْمَحُونَ ﴿٥٧﴾

---

– **həqiqətən, siz fasiq olan bir camaatsınız, fasiqlərin heç bir əməli qəbul olunmaz.**

**54)** (وَمَا مَنَعَهُمْ أَنْ تُقْبَلَ مِنْهُمْ نَفَقَاتُهُمْ إِلَّا أَنَّهُمْ كَفَرُوا بِاللَّهِ وَبِرَسُولِهِ) – **o münafiqlərin ehsan və xərclədiklərinin qəbul olunmasına onların Allah-Təalanı və onun peyğəmbərini** (Hz. Məhəmmədi) **inkar etmələrindən başqa bir şey mane deyildir. O səbəbdən onların ehsanları qəbul olunmaz.** (وَلَا يَأْتُونَ الصَّلَاةَ إِلَّا وَهُمْ كُسَالَى) – **bir də o səbəbdən qəbul olunmaz ki, namazı tənbəllikIə qılarlar,** (namaz qılıb-qılmamağın onlar üçün fərqi yoxdur. Çünki namaz qılmağın savabına, onu tərk etməyin əzabına etiqadları yoxdur). (وَلَا يُنْفِقُونَ إِلَّا وَهُمْ كَارِهُونَ) – **bir də o səbəbdən qəbul olunmaz ki, ehsan edəndə istəməyərək ehsan edərlər, heç vaxt meyil və rəğbətlə ehsan etməzlər. Hətta meyil və rəğbətlə ehsan etsələr də, onlardan qəbul olunmayacaqdır, çünki münafiqdirlər.**

**55)** (فَلَا تُعْجِبْكَ أَمْوَالُهُمْ وَلَا أَوْلَادُهُمْ) – (ey Məhəmməd), **münafiqlərin mal və övladlarının çox olması səni təəccübləndirməsin.** (إِنَّمَا يُرِيدُ اللَّهُ لِيُعَذِّبَهُمْ بِهَا فِي الْحَيَاةِ الدُّنْيَا) – **həqiqətən, Allah-Təala o mal və övladlar səbəbi ilə onlara dünyada əzab etmək istəyibdir.** (Onları övladlarının həlak olmasına və mallarının tələf olmasına düçar edər. Bu, onlardan ötrü böyük əzabdır). (وَتَزْهَقَ أَنْفُسُهُمْ وَهُمْ كَافِرُونَ) – **Allah-Təalanın istəyi odur ki, münafiqlər mal və övladları ilə məğrur olub qalsınlar, kafir olduqları halda ruhları bədənlərindən çıxsın.**

**56)** (وَيَحْلِفُونَ بِاللَّهِ إِنَّهُمْ لَمِنْكُمْ) – **o münafiqlər and içərlər ki, siz müsəlmanlardandırlar.** (وَمَا هُمْ مِنْكُمْ) – **yalan deyirlər, o münafiqlər sizdən deyillər, islam dini onların qəlblərinə daxil olmayıb.** (وَلَكِنَّهُمْ قَوْمٌ يَفْرَقُونَ) – **bəlkə, onlar sizdən qorxan camaatdırlar, sizdən qorxub, təqiyyə üçün müsəlmanlıqlarını izhar edərlər.**

**57)** (لَوْ يَجِدُونَ مَلْجَأً) – **əgər bu münafiqlər özlərindən ötrü sığınacaq bir möhkəm qala, ya bir ada tapsalar,** (أَوْ مَغَارَاتٍ) – **ya da dağlarda olan mağaralar,** (أَوْ مُدَّخَلًا) – **ya da yerdə rahat olacaqları heyvan yuvası kimi bir yer tapsalar,** (لَوَلَّوْا إِلَيْهِ وَهُمْ يَجْمَحُونَ) – **hər halda bu qeyd olunan məkanlara tərəf sürətlə qaçıb, sizdən kənar olub oranı tutarlar. Sizinlə son dərəcə ədavətləri vardır. Əgər mümkün olsa, siz müsəlmanların üzünü görməzlər.**

وَمِنْهُمْ مَنْ يَلْمِزُكَ فِي الصَّدَقَاتِ فَإِنْ أُعْطُوا مِنْهَا رَضُوا وَإِنْ لَمْ يُعْطَوْا مِنْهَا إِذَا هُمْ يَسْخَطُونَ
﴿٥٨﴾ وَلَوْ أَنَّهُمْ رَضُوا مَا آتَاهُمُ اللَّهُ وَرَسُولُهُ وَقَالُوا حَسْبُنَا اللَّهُ سَيُؤْتِينَا اللَّهُ مِنْ فَضْلِهِ وَرَسُولُهُ
إِنَّا إِلَى اللَّهِ رَاغِبُونَ ﴿٥٩﴾ إِنَّمَا الصَّدَقَاتُ لِلْفُقَرَاءِ وَالْمَسَاكِينِ وَالْعَامِلِينَ عَلَيْهَا وَالْمُؤَلَّفَةِ قُلُوبُهُمْ

---

**58) (وَمِنْهُمْ مَنْ يَلْمِزُكَ فِي الصَّدَقَاتِ)** – (ey Məhəmməd)**, bəzi* münafiqlər vardır, zəkatı böldüyündə sənə eyib tutarlar, (فَإِنْ أُعْطُوا مِنْهَا رَضُوا)** – (ey Məhəmməd)**, sənə eyib tutan şəxslərə əgər zəkatdan verilsə, razı olarlar, (وَإِنْ لَمْ يُعْطَوْا مِنْهَا إِذَا هُمْ يَسْخَطُونَ)** – **əgər zəkatdan onlara verilməsə, qəfildən onları qəzəblənən görərsən.** (Məlum olur ki, onların qəzəblənməsi Allah-Təala üçün deyil, bəlkə öz nəfslərindən ötrüdür ki, onlara zəkatdan verilməyəndə qəzəblənirlər).

*(*****Qeyd:*** *Bu şəxs Hurqus ibn Züheyrdir, ləqəbi Zül-xüveysirə və Züs-sədydir, Hz. Əlinin xilafəti zamanında peyda olan xaricilərdən bir qisminin rəisi idi. Bir qolu yox idi. Döş yerində qadın məməsi kimi bir dəri var idi. Onun üstündə pişik bığları kimi ağ tüklər çıxmışdı. Onu tutub çəkəndə uzanırdı. Bu şəxs Hz. Peyğəmbər zəkatı bölüşdürəndə ona eyib tutdu. Ömər ibn Xəttab dedi: "Ey peyğəmbər, əmr et bu kişinin başını kəsim". Buyurdu ki, sakit ol, bu kişinin elə yoldaşları olacaq ki, sizin namaz və orucunuzu öz namaz və oruclarının müqabilində bir şey saymazlar, amma ox kamandan çıxan kimi bunlar da dindən çıxarlar". Necə ki çıxdılar. (Hz. Peyğəmbər Hz. Əliyə buyurdu: Bu kişini sən qətlə yetirərsən". Hz. Əlinin xilafəti zamanında xaricilərlə olan Nəhrəvan savaşında bu kişi öldürüldü).*

**59) (وَلَوْ أَنَّهُمْ رَضُوا مَا آتَاهُمُ اللَّهُ وَرَسُولُهُ )** – **amma əgər münafiqlər Allah-Təalanın və onun peyğəmbərinin onlara verdiyi şeyə razı olub, (وَقَالُوا حَسْبُنَا اللَّهُ)** – **və desələr ki, Allah-Təala bizə kifayət edər, (سَيُؤْتِينَا اللَّهُ مِنْ فَضْلِهِ وَرَسُولُهُ)** – **Allah-Təala öz lütf və kəramətindən, onun peyğəmbəri** (Hz. Məhəmməd s.ə.s) **qənimətdən bizə sonra çox mal bəxş edər, (إِنَّا إِلَى اللَّهِ رَاغِبُونَ)** – **həqiqətən, biz dünyadan üz döndərib, Allah-Təala tərəfinə meyil və rəğbət edənik,** (əgər bu sözləri deyib Allah-Təalanın qismətinə razı olsalar, onlardan ötrü bu yaxşıdır)**.**

**60) (إِنَّمَا الصَّدَقَاتُ لِلْفُقَرَاءِ)** – (gərək, zəkat bir neçə yerə bölünsün. Bundan sonra qeyd olunacaqdır. Hz. Peyğəmbərin bölgüsünə eyib tutan sizlər əgər bu xüsusiyyətlərə sahib olsanız, sizə də zəkat verilər. Bir halda ki siz zəkat veriləcək xüsusiyyətlərə sahib deyilsiniz, sizin Hz. Peyğəmbərin bölgüsünə eyib tutmağınız caiz deyildir. Zəkat, gərək 8 təbəqəyə sərf olunsun, necə ki ayədə buyurur, ayənin mənası belədir:) **həqiqətən, zəkat, gərək, əvvəlcə yoxsullara sərf olunsun, (وَالْمَسَاكِينِ)** –**ikinci - miskinlərə,** (yoxsul miskindən də pis yaşayan şəxsə deyilir), **(وَالْعَامِلِينَ عَلَيْهَا)** – **üçüncü - zəkat toplayanlara** (onlara zəkatdan maaş verilər), **(وَالْمُؤَلَّفَةِ قُلُوبُهُمْ)** – **dördüncü – qəlbləri isinişib müsəlmanlara dost və köməkçi olsunlar, ya da sərhədləri mü-**

وَفِي الرِّقَابِ وَالْغَارِمِينَ وَفِي سَبِيلِ اللهِ وَابْنِ السَّبِيلِ فَرِيضَةً مِنَ اللهِ وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿٦٠﴾ وَمِنْهُمُ الَّذِينَ يُؤْذُونَ النَّبِيَّ وَيَقُولُونَ هُوَ أُذُنٌ قُلْ أُذُنُ خَيْرٍ لَكُمْ يُؤْمِنُ بِاللهِ وَيُؤْمِنُ لِلْمُؤْمِنِينَ وَرَحْمَةٌ لِلَّذِينَ آمَنُوا مِنْكُمْ وَالَّذِينَ يُؤْذُونَ رَسُولَ اللهِ لَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٦١﴾

---

**hafizə etsinlər deyə, müsəlman olmayan şəxslərə, (وَفِي الرِّقَابِ) - beşincisi – sahiblərinin əziyyət etdiyi qulam və kənizlərə ki, onları alıb azad edəsiniz, (وَالْغَارِمِينَ) - altıncısı - borcunu verməyə qadir olmayan şəxslərə ki, borclarını versinlər, (وَفِي سَبِيلِ اللهِ) - yeddincisi - Allah-Təala yolunda,** (din və millətin xeyir işlərində, onlara faydalı olacaq yerlərdə), **(وَابْنِ السَّبِيلِ) - səkkizincisi - müsafir olub pulu bitdiyi üçün yolda qalan şəxslərə, hətta öz ölkələrində zəngin də olsalar, gərək, zəkatdan onlara o qədər verilsin ki, öz məskənlərinə çata bilsinlər, (فَرِيضَةً مِنَ اللهِ) - bu zəkat Allah-Təala tərəfindən sizə vacib olub, gərək, verəsiniz, (وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ) - Allah-Təala hər bir şeydən agahdır, hikmət üzrə sizdən ötrü hökmlər verər.** (Zəkat hökmünü münafiqlərin əhvalatı əsnasında qeyd etməkdən məqsəd odur ki, zəkatın sərf olunacağı yerlər məlum olsun, münafiqlər zəkatdan ümidlərini kəssinlər, çünki onlar bu 8 halın heç birinə daxil deyildirlər. Bir daha Hz. Peyğəmbərin zəkatı necə bölməsinə irad tutmasınlar).

**61) (وَمِنْهُمُ الَّذِينَ يُؤْذُونَ النَّبِيَّ) - bəzi münafiqlərdən vardır ki, peyğəmbərimizə** (Hz. Məhəmmədə) **dilləri ilə əziyyət edərlər. (وَيَقُولُونَ هُوَ أُذُنٌ) - əziyyət edib deyirlər ki, bu peyğəmbər başdan-ayağa qulaqdır. Kim nə desə, onun sözünə qulaq asır. (Hz. Peyğəmbər elə mülayim bir şəxs idi ki, kim onun yanında bir şey danışsaydı, xoş üzlə o şəxsə baxıb onun sözünə qulaq asardı. Heç kimin qəlbini qırmazdı. Münafiqlər bu xüsusiyyəti ona eyib tutdular. Allah-Təala bu mübarək kitabında onların sözlərini rədd edir. (قُلْ أُذُنُ خَيْرٍ لَكُمْ)** - (ey Məhəmməd), **münafiqlərə de ki, Allah-Təala belə buyurur:** (Hz. Məhəmmədin) **sizdən ötrü başdan-ayağa qulaq olub sözlərinizə qulaq asması qəzəblənib qulaq asmamasından yaxşıdır, (يُؤْمِنُ بِاللهِ وَيُؤْمِنُ لِلْمُؤْمِنِينَ) - Hz. Məhəmməd elə yaxşı söz eşidəndir ki, Allah-Təalanın və möminlərin sözlərini eşidib təsdiq edər. (وَرَحْمَةٌ لِلَّذِينَ آمَنُوا مِنْكُمْ) - o, sizdən imana daxil olan şəxslərdən ötrü Allah-Təala tərəfindən bir rəhmətdir. (وَالَّذِينَ يُؤْذُونَ رَسُولَ اللهِ لَهُمْ عَذَابٌ أَلِيمٌ) - Allah-Təalanın peyğəmbərinə əziyyət edən şəxslərdən ötrü axirətdə şiddətli əzab vardır.** (Zənn edilməsin ki, bu əziyyət ancaq Hz. Peyğəmbərə sağlığında əziyyət edən şəxslərə aiddir, əksinə, bu zamana kimi o cənabın dinini, sünnəsini dəyişdirib, bidətlər yaradan saxta alimlər o cənabın mübarək ruhuna əziyyət etmiş hesab olunur, bu ayədə vəd edilən əzab onlara da aiddir).

يَحْلِفُونَ بِاللَّهِ لَكُمْ لِيُرْضُوكُمْ وَاللَّهُ وَرَسُولُهُ أَحَقُّ أَنْ يُرْضُوهُ إِنْ كَانُوا مُؤْمِنِينَ ﴿٦٢﴾ أَلَمْ يَعْلَمُوا أَنَّهُ
مَنْ يُحَادِدِ اللَّهَ وَرَسُولَهُ فَأَنَّ لَهُ نَارَ جَهَنَّمَ خَالِدًا فِيهَا ذَلِكَ الْخِزْيُ الْعَظِيمُ ﴿٦٣﴾ يَحْذَرُ الْمُنَافِقُونَ
أَنْ تُنَزَّلَ عَلَيْهِمْ سُورَةٌ تُنَبِّئُهُمْ بِمَا فِي قُلُوبِهِمْ قُلِ اسْتَهْزِئُوا إِنَّ اللَّهَ مُخْرِجٌ مَا تَحْذَرُونَ ﴿٦٤﴾ وَلَئِنْ
سَأَلْتَهُمْ لَيَقُولُنَّ إِنَّمَا كُنَّا نَخُوضُ وَنَلْعَبُ

---

**62) (يَحْلِفُونَ بِاللَّهِ لَكُمْ لِيُرْضُوكُمْ) – münafiqlər siz müsəlmanları özlərindən razı salmaq üçün Allah-Təalaya and içərlər,** (münafiqlər xəlvətdə islama və müsəlmanlara eyib tutub tənə edirdilər, müsəlmanları görəndə isə and içirdilər ki, belə söz deməyiblər. Allah-Təala bu ayədə onları rədd edir). **(وَاللَّهُ وَرَسُولُهُ أَحَقُّ أَنْ يُرْضُوهُ إِنْ كَانُوا مُؤْمِنِينَ) – və münafiqlər əgər siz müsəlmanları razı salmaq üçün and içsələr də, onlara bir fayda verməz, onlar yalandan and içirlər. Siz də onların batinlərindən agah deyilsiniz, əgər onlar həqiqətən mömindirlərsə, Allah-Təalanı və onun peyğəmbərini özlərindən razı salmaları daha vacibdir, gərək, nifaqdan tövbə edib xalis mömin olsunlar).**

**63) (أَلَمْ يَعْلَمُوا أَنَّهُ مَنْ يُحَادِدِ اللَّهَ وَرَسُولَهُ) – bəs münafiqlər bilmirlər ki, həqiqətən, kim Allah-Təalaya və onun peyğəmbərinə müxalif olub onların itaətindən çıxsa, (فَأَنَّ لَهُ نَارَ جَهَنَّمَ خَالِدًا فِيهَا) – həqiqətən, belə şəxsdən ötrü cəhənnəm odu vardır. Cəhənnəm odunun əzabında həmişəlik qalacaqlar. (ذَلِكَ الْخِزْيُ الْعَظِيمُ) – cəhənnəm odunda əzab içində olmaq böyük zillətdir.**

**64) (يَحْذَرُ الْمُنَافِقُونَ أَنْ تُنَزَّلَ عَلَيْهِمْ سُورَةٌ تُنَبِّئُهُمْ بِمَا فِي قُلُوبِهِمْ) – münafiqlər islama və müsəlmanlara istehza edirlər, amma qorxurlar ki, onların haqqında möminlərə bir surə nazil olub o surədə möminlərə münafiqlərin qəlblərində olan sözlərini xəbər verər.** (Təbük savaşına gedəndə münafiqlərdən bir dəstə bir-birilərinə deyirdilər: "Bu kişiyə (peyğəmbərə) baxın, istəyir ki, Şamın qalalarını və qəsrlərini fəth etsin. Çox uzaq xəyaldır," bu sözləri istehza ilə deyirdilər. Amma onların haqqında Quran surəsinin nazil olub işlərinin aşkar olmasından qorxurdular. Allah-Təala Hz. Peyğəmbərə onların bu sözlərini xəbər verdi. Hz. Peyğəmbər münafiqləri çağırdı, onlar da and içdilər ki, sənin və səhabələrin haqqında heç bir söz deməyiblər. Bir-birimizlə söhbət edirdik ki, səfərimiz asan keçsin. Bu ayələrdə Allah-Təala bu mətləbə işarə edir). **(قُلِ اسْتَهْزِئُوا إِنَّ اللَّهَ مُخْرِجٌ مَا تَحْذَرُونَ)** – (ey Məhəmməd)**, o münafiqlərə de ki, siz istehza edin, amma o şeydən ki, qorxursunuz, Allah-Təala onu aşkar edəcəkdir.** (Yəni bir Quran surəsini nazil edib gizlətdiyiniz əməllərinizi zahir edəcək, necə ki həmin surənin ayələrində bəyan edir).

**65) (وَلَئِنْ سَأَلْتَهُمْ لَيَقُولُنَّ إِنَّمَا كُنَّا نَخُوضُ وَنَلْعَبُ)** – (ey Məhəmməd)**, əgər o münafiqlərdən soruşsan ki, bu nə sözlərdir, deyirsiniz? Hər halda, sənə deyərlər ki, həqiqətən, biz batil sözlər danışıb zarafatlaşıb, əylənirdik ki,**

**قُلْ أَبِاللَّهِ وَآيَاتِهِ وَرَسُولِهِ كُنْتُمْ تَسْتَهْزِئُونَ ﴿٦٥﴾ لَا تَعْتَذِرُوا قَدْ كَفَرْتُمْ بَعْدَ إِيمَانِكُمْ إِنْ نَعْفُ عَنْ طَائِفَةٍ مِنْكُمْ نُعَذِّبْ طَائِفَةً بِأَنَّهُمْ كَانُوا مُجْرِمِينَ ﴿٦٦﴾ الْمُنَافِقُونَ وَالْمُنَافِقَاتُ بَعْضُهُمْ مِنْ بَعْضٍ يَأْمُرُونَ بِالْمُنْكَرِ وَيَنْهَوْنَ عَنِ الْمَعْرُوفِ وَيَقْبِضُونَ أَيْدِيَهُمْ نَسُوا اللَّهَ فَنَسِيَهُمْ إِنَّ الْمُنَافِقِينَ هُمُ الْفَاسِقُونَ ﴿٦٧﴾**

---

**yol getmək asan olsun. (قُلْ أَبِاللَّهِ وَآيَاتِهِ وَرَسُولِهِ كُنْتُمْ تَسْتَهْزِئُونَ)** – (ey Məhəmməd), **o münafiqlərə de ki, sizin bu üzrxahlığınız qəbul edilən deyil, Allah-Təalaya, onun ehkamına və peyğəmbərinə istehza edirsiniz?** (Bu istehzanın cəzasını çəkəcəksiniz)**.**

**66) (لَا تَعْتَذِرُوا) – istehza etdiyiniz üçün yalandan üzrxahlıq etməyin, heç bir üzrünüz qəbul olunmaz. (قَدْ كَفَرْتُمْ بَعْدَ إِيمَانِكُمْ) – həqiqətən, istehza etmək üçün iman izhar edəndən sonra küfrünüz zahir oldu. (إِنْ نَعْفُ عَنْ طَائِفَةٍ مِنْكُمْ) – əgər siz münafiqlərin bir qrupunu** (tövbə edənləri) **əfv etsək də, (نُعَذِّبْ طَائِفَةً بِأَنَّهُمْ كَانُوا مُجْرِمِينَ)** – (tövbə etməyib) **Allah-Təalaya asi olduqları üçün digər dəstəyə əzab edərik.**

**67) (الْمُنَافِقُونَ وَالْمُنَافِقَاتُ بَعْضُهُمْ مِنْ بَعْضٍ) – münafiq kişilər və qadınlar bir-birilərinin eynidir. Bir-birilərini dost tutarlar, and içərlər ki, biz də müsəlmanlardanıq. Yalan deyirlər, sizdən deyillər. (يَأْمُرُونَ بِالْمُنْكَرِ وَيَنْهَوْنَ عَنِ الْمَعْرُوفِ) – onların xüsusiyyəti budur ki, pis və qəbih əməlləri** (Allah-Təalaya asi olmağı) **əmr edib, imana daxil olmağı qadağan edərlər. (وَيَقْبِضُونَ أَيْدِيَهُمْ) – yenə münafiqlərin xüsusiyyətlərindən biri budur ki, əllərini bağlayıb əllərində olan mallardan ehsan* etməzlər. (نَسُوا اللَّهَ فَنَسِيَهُمْ) – Allah-Təalanı yadlarından çıxardıb heç vaxt Onu zikr etməzlər. O səbəbdən Allah-Təala da onları yaddan çıxarıb öz lütf və rəhmətini onlardan kəsər.** (Bu xüsusiyyətlər münafiqlərin xüsusiyyətləridir, möminlərdə belə xüsusiyyətlər olmaz). **Hərçənd özləri and içib deyirlər ki, biz də siz möminlərdənik, bununla belə o münafiqlər necə sizdən ola bilər? (إِنَّ الْمُنَافِقِينَ هُمُ الْفَاسِقُونَ) – həqiqətən, münafiqlər nifaq salmada inadkar və asilikdə kamildirlər.**

*(****Qeyd:*** *Bu ayənin hökmüylə Allah-Təalaya, Qurana və peyğəmbərə iman gətirən o şəxsdir ki, xeyri əmr, şəri qadağan edər, əlində olan dünya malını Allah-Təala yolunda, ümmətin övladlarının ehtiyacı yolunda sərf edər. Kimdə bu xüsusiyyətlər olmayıb bunların ziddi olsa, o şəxs mömin deyil, münafiqlərin cərgəsinə daxildir, biz müsəlmanlar özümüzü mömin hesab edirik, amma qeyd olunan bu mömin xüsusiyyətlərin heç biri bizdə yoxdur, Qurani-Şərifin hökmlərinə əməl etməyən şəxs öz adını necə müsəlman qoya bilər? Zənginlər bir fikir versinlər, hansı ayədə asilər və münafiqlər məzəmmət olunur, onun arxasınca ehsan və sədəqə verməyi tərk edən şəxslər də məzəmmət olunurlar, ar olsun dünya malını yığıb saxlayan şəxslərə, dünya malını elə yerdə sərf etmək lazımdır ki, insanın əbədi səadətinə bais olub, adı həmişə*

وَعَدَ اللّهُ الْمُنَافِقِينَ وَالْمُنَافِقَاتِ وَالْكُفَّارَ نَارَ جَهَنَّمَ خَالِدِينَ فِيهَا هِيَ حَسْبُهُمْ وَلَعَنَهُمُ اللّهُ وَلَهُمْ
عَذَابٌ مُقِيمٌ ﴿٦٨﴾ كَالَّذِينَ مِنْ قَبْلِكُمْ كَانُوا أَشَدَّ مِنْكُمْ قُوَّةً وَأَكْثَرَ أَمْوَالًا وَأَوْلَادًا فَاسْتَمْتَعُوا
بِخَلَاقِهِمْ فَاسْتَمْتَعْتُمْ بِخَلَاقِكُمْ كَمَا اسْتَمْتَعَ الَّذِينَ مِنْ قَبْلِكُمْ بِخَلَاقِهِمْ وَخُضْتُمْ كَالَّذِي خَاضُوا
أُولَئِكَ حَبِطَتْ أَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْآَخِرَةِ وَأُولَئِكَ هُمُ الْخَاسِرُونَ ﴿٦٩﴾

---

*xeyirlə zikr edilsin. Necə ki keçmiş zamanlarda xeyirxah işlər görən şəxslərin ortaya qoyduqları müəssisələr nə qədər ki yaşayır, onların qurucularının da adları dünyada həmişə yaşayacaqdır).*

**68) (وَعَدَ اللّهُ الْمُنَافِقِينَ وَالْمُنَافِقَاتِ وَالْكُفَّارَ نَارَ جَهَنَّمَ خَالِدِينَ فِيهَا) – Allah-Təala münafiq kişilərə, münafiq qadınlara və kafir şəxslərə cəhənnəm əzabını vəd edibdir və cəhənnəmdə qalmalarını təyin edibdir (هِيَ حَسْبُهُمْ) – cəhənnəm əzabı onlara kifayət edər. Onlara daha başqa əzab lazım deyil, cəhənnəm əzabından böyük əzab olmaz. (وَلَعَنَهُمُ اللّهُ) – Allah-Təala bu əzabla birlikdə onlara lənət edib öz rəhmətindən kənar edər, heç vaxt onlara rəhmət edib, əzabından xilas etməz, (وَلَهُمْ عَذَابٌ مُقِيمٌ) – onlardan ötrü həmişəlik əzab vardır.**

**69) (كَالَّذِينَ مِنْ قَبْلِكُمْ) – siz münafiqlərin əməlləri sizdən əvvəl dünyada olan o münafiqlərin əməlləri kimidir. (كَانُوا أَشَدَّ مِنْكُمْ قُوَّةً) – qüvvətləri sizdən artıq və möhkəm idilər. (وَأَكْثَرَ أَمْوَالًا وَأَوْلَادًا) – və sizdən çox malları və övladları var idi. (فَاسْتَمْتَعُوا بِخَلَاقِهِمْ) – sizdən əvvəl dünyada onlara qismət edilən dünya malından ləzzət aldılar. O ləzzətlərlə məşğul olub, Allah-Təaladan qafil olub şükür etmədilər. Nəfsani arzularına əməl etmək onları Allah-Təaladan uzaqlaşdırdı. (فَاسْتَمْتَعْتُمْ بِخَلَاقِكُمْ) – siz münafiqlər də nəfsani istəklərə tabe olub dünyada qismətiniz olan mallardan ləzzət alıb, Allah-Təaladan qafil olub şükür etmədiniz. (كَمَا اسْتَمْتَعَ الَّذِينَ مِنْ قَبْلِكُمْ بِخَلَاقِهِمْ) – necə ki sizdən əvvəlki şəxslər nəfsani arzulara tabe olub, öz qismətlərindən ləzzət alıb, Allah-Təaladan qafil oldular.** (Siz münafiqlər küfr və inadda onlara bərabərsiniz, baxın görün, onlardan ötrü nə əzab olubsa, sizdən ötrü də o cür əzab olacaqdır). (وَخُضْتُمْ كَالَّذِي خَاضُوا) – özünüzdən əvvəlkilər kimi siz münafiqlər də batil və **boş əməllərə qurşandınız. Görün onların dünyadakı yaxşı əməlləri nə oldu? Onlara heç bir fayda vermədi. Sizin də əməlləriniz o cür olacaqdır. (أُولَئِكَ حَبِطَتْ أَعْمَالُهُمْ فِي الدُّنْيَا وَالْآَخِرَةِ) – sizdən əvvəlki münafiqlərin əməlləri dünyada və axirətdə batil oldu,** (sizin də əməlləriniz onlar kimi batil olacaqdır). **(وَأُولَئِكَ هُمُ الْخَاسِرُونَ) – əlbəttə, onlar özlərinə ziyan vuranlardır. Onlara əzab edilməsinin səbəbi öz əməlləridir.** (Habelə siz münafiqlər də özünüzə zərər verib, əməlləriniz axirətdə sizə əzab edilməsinə səbəb olacaqdır).

**أَلَمْ يَأْتِهِمْ نَبَأُ الَّذِينَ مِنْ قَبْلِهِمْ قَوْمِ نُوحٍ وَعَادٍ وَثَمُودَ وَقَوْمِ إِبْرَاهِيمَ وَأَصْحَابِ مَدْيَنَ وَالْمُؤْتَفِكَاتِ أَتَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ فَمَا كَانَ اللَّهُ لِيَظْلِمَهُمْ وَلَكِنْ كَانُوا أَنْفُسَهُمْ يَظْلِمُونَ ﴿٧٠﴾ وَالْمُؤْمِنُونَ وَالْمُؤْمِنَاتُ بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ يَأْمُرُونَ بِالْمَعْرُوفِ وَيَنْهَوْنَ عَنِ الْمُنْكَرِ وَيُقِيمُونَ الصَّلَاةَ وَيُؤْتُونَ الزَّكَاةَ وَيُطِيعُونَ اللَّهَ وَرَسُولَهُ أُولَئِكَ سَيَرْحَمُهُمُ اللَّهُ إِنَّ اللَّهَ عَزِيزٌ حَكِيمٌ ﴿٧١﴾ وَعَدَ اللَّهُ الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا**

---

**70) (أَلَمْ يَأْتِهِمْ نَبَأُ الَّذِينَ مِنْ قَبْلِهِمْ) – bəs bu münafiqlərə onlardan əvvəlki camaatların xəbərləri yetişməyibdir?** (Asi olub tüğyan etdikləri üçün Allah-Təala onlara necə əzab etdi?) (قَوْمِ نُوحٍ وَعَادٍ وَثَمُودَ وَقَوْمِ إِبْرَاهِيمَ وَأَصْحَابِ مَدْيَنَ وَالْمُؤْتَفِكَاتِ) **– əzab olunan camaatlar bunlardır: Nuh peyğəmbərin camaatı, Hud peyğəmbərin qövmü, Ad camaatı, Saleh peyğəmbərin qövmü, Səmud camaatı, İbrahim peyğəmbərin camaatı, Şüeyb peyğəmbərin qövmü, Mədyən şəhərinin camaatı, Mötəfikilər*** (Lut peyğəmbərin əhlinin yaşadığı yer) **(أَتَتْهُمْ رُسُلُهُمْ بِالْبَيِّنَاتِ) – bu qeyd olunan camaatlara da peyğəmbərləri aşkar olan möcüzələrlə gəldilər, möcüzələri qəbul etməyib peyğəmbərlərə iman gətirmədilər. Allah-Təala onlara əzab göndərib həlak etdi. (فَمَا كَانَ اللَّهُ لِيَظْلِمَهُمْ) – Allah-Təala onlara zülm edən deyil, (وَلَكِنْ كَانُوا أَنْفُسَهُمْ يَظْلِمُونَ) – lakin onlar özlərinə zülm edib, Allaha itaətdən çıxıb, əzaba layiq oldular.**

*(****Qeyd:*** *Mötəfikat - Fələstində bir yerin adıdır. Orada 7 qəsəbə var idi. Lut onlara göndərildi, onlara Sodom da deyilir, bu camaatların hamısını Allah-Təala həlak edib, axirətdə də onlara əzab edəcəkdir).*

**71) (وَالْمُؤْمِنُونَ وَالْمُؤْمِنَاتُ بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ) – mömin kişilər və mömin qadınlar bir-birilərini dost tutarlar,** (Necə ki münafiqlər bir-birilərini dost tutarlar)**, yoxsa münafiqlər möminləri dost tutmazlar. (يَأْمُرُونَ بِالْمَعْرُوفِ) – möminlərin xüsusiyyəti budur: yaxşı və gözəl şeyləri əmr edib, (وَيَنْهَوْنَ عَنِ الْمُنْكَرِ) – pis və xəbis əməlləri qadağan edərlər. (وَيُقِيمُونَ الصَّلَاةَ) – namazı qılıb həmişə yerinə yetirərlər. (وَيُؤْتُونَ الزَّكَاةَ) – mallarının zəkatını** (10-da bir hissəsini) **verərlər. (وَيُطِيعُونَ اللَّهَ وَرَسُولَهُ) – bütün hökmlərdə Allah-Təalaya və onun peyğəmbərinə itaət edərlər. (أُولَئِكَ سَيَرْحَمُهُمُ اللَّهُ) – belə mömin şəxslərə, əlbəttə, Allah-Təala rəhm edib onlara lütf və rəhmətini şamil edib, uca cənnətdə onlara ev bəxş edəcəkdir,** (Necə ki münafiqləri rəhmətindən kənar edib cəhənnəmə daxil edəcəkdir)**. (إِنَّ اللَّهَ عَزِيزٌ حَكِيمٌ) – həqiqətən, Allah-Təala bütün məxluqata qalibdir. Hər kəsə hikmət üzrə öz əməlinin cəzasını verəcəkdir.**

**72) (وَعَدَ اللَّهُ الْمُؤْمِنِينَ وَالْمُؤْمِنَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ) – Allah-Təala mömin kişilərə və mömin qadınlara axirətdə ağaclarının və qəsrlərinin altından çaylar axan cənnətləri vəd edibdir. (خَالِدِينَ فِيهَا) – o cənnətlərdə həmişəlik**

وَمَسَاكِنَ طَيِّبَةً فِي جَنَّاتِ عَدْنٍ وَرِضْوَانٌ مِنَ اللهِ أَكْبَرُ ذَلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ ﴿٧٢﴾ يَا أَيُّهَا النَّبِيُّ
جَاهِدِ الْكُفَّارَ وَالْمُنَافِقِينَ وَاغْلُظْ عَلَيْهِمْ وَمَأْوَاهُمْ جَهَنَّمُ وَبِئْسَ الْمَصِيرُ ﴿٧٣﴾ يَحْلِفُونَ بِاللهِ مَا
قَالُوا وَلَقَدْ قَالُوا كَلِمَةَ الْكُفْرِ

---

**qalacaqlar, (وَمَسَاكِنَ طَيِّبَةً فِي جَنَّاتِ عَدْنٍ) – yenə möminlərə Ədn bağlarında pak və gözəl olan mənzillər və qəsrlər* vəd edibdir, (وَرِضْوَانٌ مِنَ اللهِ أَكْبَرُ) – bu şeyləri Allah-Təala möminlərə vəd edir. Amma Allah-Təalanın öz bəndəsindən az da olsa razı qalması bu qeyd olunan şeylərdən böyükdür,** (Allah-Təalanın bəndəsindən razı olması bu şeylərin hamısını yaddan çıxarar, çünki dost dostunun razılığını sevər, ondan başqa heç bir şey istəməz). **(ذَلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ) – Allah-Təalanın cüzi bir razılığı böyük nemətə vasil olmaqdır, ondan böyük nemət olmaz.**

*(***Qeyd:** Ədn - behiştin bir qisminin adıdır).*

**73) (يَا أَيُّهَا النَّبِيُّ جَاهِدِ الْكُفَّارَ وَالْمُنَافِقِينَ) – ey peyğəmbər,** (yəni ey Məhəmməd s.ə.s) **müşrik və münafiqlərlə silah vasitəsilə cihad et, amma münafiqlərlə dəlil və sübutla cihad et, bəlkə, nifaqlarından qayıdıb imana daxil olsunlar, əgər itaət etməsələr, müşrikləri qətlə yetir. (وَاغْلُظْ عَلَيْهِمْ) – müşrik və münafiqlərlə cihad etməkdə** (müşriklərə savaşmaqda, münafiqlərə dəlil və sübut gətirməkdə) **şiddətli və qəzəbli ol, (وَمَأْوَاهُمْ جَهَنَّمُ وَبِئْسَ الْمَصِيرُ) – əgər iman gətirməsələr, onların axirətdəki məskənləri cəhənnəmdir, nə pis dönüləcək yerdir cəhənnəm.** (Hz. Peyğəmbər Təbük səfərində bir neçə gün yubandı, o günlərdə bu ayələr Hz. Peyğəmbərlə cihada getməyib Mədinədə qalan münafiqlər haqqında nazil oldu. Münafiqlərdən bir nəfər –Cülas ibn Süveyd adlı şəxs dedi: "Əgər Məhəmmədin Mədinədə qoyub gəldiyimiz qardaşlarımız, ağalarımız və rəislərimiz haqqında dediyi sözlər haqdırsa, onların halı belə olanda biz ulaqdan betər olarıq," (bu sözü istehza ilə dedi). Ənsar möminlərindən Amir ibn Qeys dedi: "Bəli belədir, Məhəmməd hər bir sözündə sadiq və sən ulaqdan betərsən". Bu söhbəti Hz. Peyğəmbər eşitdi. Cülas ibn Süveydi çağırdı. Cülas and içdi ki, elə söz deməyib. Amir əllərini yuxarıya qaldırıb dedi: "İlahi, mən yalançının təsdiqini, bu doğru deyənin təkzibini peyğəmbərinə nazil et". Ondan sonra Hz. Peyğəmbər Təbükdən qayıdanda münafiqlər Hz. Peyğəmbərə zərər vurmaq məqsədilə məşvərət etdilər. Hz. Peyğəmbər təpənin yamacına çıxanda münafiqlərdən 12 nəfər Hz. Peyğəmbərə hücum etmək istədi, amma Hz. Peyğəmbər bundan xəbərdar olub, münafiqlərin istəyi reallaşmadı. Hz. Peyğəmbərin önündə Əmmar ibn Yasir, arxasınca Huzeyfə ibnül-Yaman gedirdi. Birdən dəvə səsi eşitdi. Hz. Peyğəmbər o münafiqləri Huzeyfəyə xəbər verdi. Bu barədə sıradakı ayə nazil oldu).

**74) (يَحْلِفُونَ بِاللهِ مَا قَالُوا) – münafiqlər Allah-Təalaya and içirlər ki, heç bir söz deməyiblər,** (Necə ki Cülas and içdi), **(وَلَقَدْ قَالُوا كَلِمَةَ الْكُفْرِ) – yalandan**

وَكَفَرُوا بَعْدَ إِسْلَامِهِمْ وَهَمُّوا بِمَا لَمْ يَنَالُوا وَمَا نَقَمُوا إِلَّا أَنْ أَغْنَاهُمُ اللَّهُ وَرَسُولُهُ مِنْ فَضْلِهِ فَإِنْ يَتُوبُوا يَكُ خَيْرًا لَهُمْ وَإِنْ يَتَوَلَّوْا يُعَذِّبْهُمُ اللَّهُ عَذَابًا أَلِيمًا فِي الدُّنْيَا وَالْآخِرَةِ وَمَا لَهُمْ فِي الْأَرْضِ مِنْ وَلِيٍّ وَلَا نَصِيرٍ ﴿٧٤﴾

---

**and içirlər, həqiqətən, söyləməklə kafir olduqları o küfr kəlməsini dedilər. (وَكَفَرُوا بَعْدَ إِسْلَامِهِمْ) – və müsəlman olduqdan sonra kafir olduqlarını aşkar etdilər. (وَهَمُّوا بِمَا لَمْ يَنَالُوا) – münafiqlər müvəffəq ola bilmədikləri bir işə girişdilər (Təbükdən qayıdanda Hz. Peyğəmbəri qətlə yetirmək istədilər), (وَمَا نَقَمُوا إِلَّا أَنْ أَغْنَاهُمُ اللَّهُ وَرَسُولُهُ مِنْ فَضْلِهِ) – və sırf Allah-Təala və peyğəmbəri öz lütfləri ilə onları varlı etdiyi üçün Hz. Peyğəmbərə eyib tutub onu qətl etmək istədilər, halbuki hamısı yoxsul idi. Peyğəmbərin mübarək gəlişi ilə Allah-Təala onları zəngin etdi. Bunun əvəzində gərək şükür edəydilər. Amma kafir olub ona eyib tutub, istehza edib, qətlə yetirmək istədilər). (فَإِنْ يَتُوبُوا يَكُ خَيْرًا لَهُمْ) – əgər münafiqlər tövbə etsə, tövbə onlardan ötrü yaxşıdır, Allah-Təala tövbələrini qəbul edər. (وَإِنْ يَتَوَلَّوْا يُعَذِّبْهُمُ اللَّهُ عَذَابًا أَلِيمًا فِي الدُّنْيَا وَالْآخِرَةِ) – əgər tövbədən üz döndərsələr, Allah-Təala onlara dünya və axirətdə şiddətli əzab edər. (وَمَا لَهُمْ فِي الْأَرْضِ مِنْ وَلِيٍّ وَلَا نَصِيرٍ) – onlardan ötrü yer üzündə nə bir dost, nə bir kömək edən olmaz.** (Səhabədən Sələbə ibn Hatib adlı şəxs dedi: "Ey Peyğəmbər, dua et ki Allah-Təala mənə çox mal versin". Hz. Peyğəmbər buyurdu: "Ey Sələbə, şükür edəcəyin az mal səni şükürsüz edən çox maldan yaxşıdır". Sələbə yenidən dedi:"Ey Peyğəmbər, səni haqq peyğəmbər olaraq göndərən Allah-Təalaya and olsun ki, əgər Allah-Təala mənə çox mal versə, Allah-Təalanın o malda qoyduğu hər bir haqqını ödəyərəm". Hz. Peyğəmbər ondan ötrü dua etdi. Bir neçə qoyunu, keçisi var idi, Allah-Təala onlara bərəkət verib ilbəil artdı. Mədinə onlara dar gəldi. Sələbə köçüb Mədinədən kənar bir yerdə məskən saldı. Cümə namazına gələ bilmədi. Hz. Peyğəmbər Sələbəni soruşdu, dedilər ki, malı elə çoxalıb ki, biyabana sığmır. Buyurdu: "Vay olsun Sələbəyə," ondan sonra Hz. Peyğəmbər zəkat toplamaq üçün iki nəfər göndərdi. Hər yerdən zəkat aldılar. Sələbənin də yanına gedib zəkat istədilər. Peyğəmbərin hökmünü ona oxudular. Dedi: "Belə zəkat olar? Bu cizyədir, müsəlman şəxsdən cizyə almazlar. Qayıdıb gedin, mən də bir fikirləşim". Qayıdıb gəldilər. Elə ki Hz. Peyğəmbər onları gördü, buyurdu: "Vay olsun Sələbəyə". Ondan sonra o şəxslər Sələbənin əhvalatını peyğəmbərə nəql etdilər. Ondan sonra bu ayə nazil oldu. Sələbə malının zəkatını toplayıb, Hz. Peyğəmbərə gətirdi. Hz. Peyğəmbər buyurdu: "Allah-Təala səndən zəkatı qəbul etməyi qadağan edir, - onun zəkatını qəbul etmədi". Sələbə eyvah edib başına torpaq tökdü. Hz. Peyğəmbərin vəfatından sonra o zəkatı Əbu Bəkirin hüzuruna gətirdi. Əbu Bəkir qəbul etmədi. Əbu Bəkirdən sonra Ömər ibn Xəttabın hüzuruna gətirdi, o da qəbul etmədi. Ömərdən sonra

وَمِنْهُمْ مَنْ عَاهَدَ اللَّهَ لَئِنْ آتَانَا مِنْ فَضْلِهِ لَنَصَّدَّقَنَّ وَلَنَكُونَنَّ مِنَ الصَّالِحِينَ ﴿٧٥﴾ فَلَمَّا آتَاهُمْ مِنْ
فَضْلِهِ بَخِلُوا بِهِ وَتَوَلَّوْا وَهُمْ مُعْرِضُونَ ﴿٧٦﴾ فَأَعْقَبَهُمْ نِفَاقًا فِي قُلُوبِهِمْ إِلَى يَوْمِ يَلْقَوْنَهُ بِمَا أَخْلَفُوا
اللَّهَ مَا وَعَدُوهُ وَبِمَا كَانُوا يَكْذِبُونَ ﴿٧٧﴾

---

Osman ibn Əffanın hüzuruna gətirdi. O da qəbul etmədi. Osmanın zamanında Sələbə həlak oldu. Hz. Peyğəmbərin Sələbədən zəkatı qəbul etməməsi buna işarədir ki, gərək, hər bir şəxs üzərindəki borcunu xoşluqla, fərəh və sevinclə versin, nəinki qorxu və riya ilə Belə olanda, gərək, ondan qəbul olunmasın. Ayə budur:)

**75) (وَمِنْهُمْ مَنْ عَاهَدَ اللَّهَ) – münafiqlərdən bəzi şəxslər var ki, Allah-Təala ilə belə əhd edərlər: (لَئِنْ آتَانَا مِنْ فَضْلِهِ لَنَصَّدَّقَنَّ) – əgər Allah-Təala bizə öz lütf və rəhmətindən dünya malı bəxş etsə, əlbəttə, o malın zəkatını verib, Allah-Təalanın buyurduğu kimi əməl edərik. (وَلَنَكُونَنَّ مِنَ الصَّالِحِينَ) – əlbəttə, saleh şəxslərdən olub Allah-Təalanın itaətindən heç vaxt çıxmarıq, (Necə ki Sələbə dedi, hər bir zamanda onun kimi belə söz deyənlər çox olubdur. Elə ki Allah-Təala dünya malı bəxş edir, tüğyan edib Allah-Təalanı inkar edərlər). (أَصْحَابَ) – biz öz zəmanəmizdə belə şəxsləri çox görmüşük. Belə şəxslərin olması bəsirət sahiblərinə məxfi deyildir).**

**76) (فَلَمَّا آتَاهُمْ مِنْ فَضْلِهِ بَخِلُوا بِهِ) – elə ki Allah-Təala öz lütf və rəhmətindən onlara dünya malı bəxş etdi, xəsislik edib, Allah-Təalanın vacib etdiyi zəkatı da vermədilər. (وَتَوَلَّوْا وَهُمْ مُعْرِضُونَ) – Allah-Təala ilə etdikləri əhdlərindən üz döndərdilər və əhdlərinə sadiq olmadılar.**

**77) (فَأَعْقَبَهُمْ نِفَاقًا فِي قُلُوبِهِمْ إِلَى يَوْمِ يَلْقَوْنَهُ) – Allah-Təala onların qəlblərində nifaqa yer verdi, Allah-Təala ilə qarşılaşacaqları günə qədər heç vaxt qəlblərindən nifaq çıxmaz.** (Qəlbləri nifaqla dolu və özləri münafiq olaraq qiyamətdə dirilərlər). **(بِمَا أَخْلَفُوا اللَّهَ مَا وَعَدُوهُ) – iki səbəbə görə, Allah-Təala onların qəlblərində nifaqa yer verdi, bir o səbəbə görə ki, Allah-Təala ilə əhd edib vəd etmişdilər ki, mallarından sədəqə və zəkat versinlər, əhdi pozub vədlərinə vəfa etmədilər, (وَبِمَا كَانُوا يَكْذِبُونَ) – bir də o səbəbə görə ki, yalan danışan idilər.** (Kimdə bu iki xüsusiyyət olsa, o şəxs münafiqdir, bir* hədisdə münafiqin 3 xüsusiyyəti nəql olunubdur. İkisi bu ayədə zikr olunan, 3-cüsü əmanətə xəyanət eyləməkdir. Buyurubdur: “Kimdə bu 3 xüsusiyyət olsa, o şəxs münafiqdir”. Müsəlmanlar bu sözlərdən ibrət götürsünlər).

*(*****Qeyd:** Hədisin ayə ilə ziddiyyəti yoxdur, ayədə münafiqlərin xüsusiyyəti iki şeylə məhdudlaşdırılmayıbdır ki, hədis ona zidd olub Qurana müxalifi olsun, bəlkə, ayədə münafiqlərin bu iki xüsusiyyəti qeyd olunubdur, ola bilər, münafiqlərin başqa xüsusiyyətləri də olsun. O səbəbdən hədisdə 3-cü xüsusiyyət bəyan olundu).*

أَلَمْ يَعْلَمُوا أَنَّ اللَّهَ يَعْلَمُ سِرَّهُمْ وَنَجْوَاهُمْ وَأَنَّ اللهَ عَلَّامُ الْغُيُوبِ ﴿٧٨﴾ الَّذِينَ يَلْمِزُونَ الْمُطَّوِّعِينَ مِنَ الْمُؤْمِنِينَ فِي الصَّدَقَاتِ وَالَّذِينَ لَا يَجِدُونَ إِلَّا جُهْدَهُمْ فَيَسْخَرُونَ مِنْهُمْ سَخِرَ اللهُ مِنْهُمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ ﴿٧٩﴾

---

**78) (أَلَمْ يَعْلَمُوا أَنَّ اللهَ يَعْلَمُ سِرَّهُمْ وَنَجْوَاهُمْ) – bəs münafiqlər bilmirlər ki, həqiqətən, Allah-Təala onların batinlərində olan nifaqa və bir-biriləri ilə gizlin danışıb islama eyib tutub tənə etdiklərindən agahdır? (وَأَنَّ اللهَ عَلَّامُ الْغُيُوبِ) – həqiqətən, Allah-Təala bütün qeyb işlərindən xəbərdardır və heç bir şey onun elmindən kənar qalmaz.** (Təbük savaşı şiddətli isti bir havada vaqe oldu, Mədinədə yeməli şey az tapıldığı halda, müsəlmanlar Təbük savaşına gedən qoşuna kömək etdilər. Əbdürrəhman ibn Əfv 4 min dirhəm gətirdi, dedi: “Ey Peyğəmbər, 8 min dirhəm varımdır, 4 min dirhəm gətirdim. Allah-Təaladan ötrü islam yolunda sərf olunsun, 4 min dirhəm də ailəmdən ötrü saxladım”. Hz. Peyğəmbər buyurdu: “Allah-Təala gətirdiyinə və saxladığına bərəkət versin”. (Əbdürrəhman çox zənginləşdi, vəfat edəndə 4 xanımı var idi, Təmazər adlı xanımına malının 8-də 1 hissəsi - 80 min misqal qızıl miras qaldı. Hz. Peyğəmbər heç kimə deməyib ki, mal-dövlət pisdir, yoxsul olmaq yaxşıdır, necə ki bu zamanın quldurları xalqın əlindən malını almaqdan ötrü belə sözlər deyirlər. Bəli, insanı Allah-Təaladan uzaqlaşdıran hər bir şey pisdir, mal, ya da başqa şey olsun, fərqi yoxdur. Asim ibn Ədy 100 “vəsəq” (1 vəsəq - 130 kq.) xurma gətirdi, Əbu Bəkir bütün malını gətirib belə dedi: “Ey peyğəmbər, Allah-Təala mənə mal bəxş etsə, onları da Allah-Təala yolunda sərf edərəm”. Ömər malının yarısını gətirdi. Dedi: Ey peyğəmbər, Allah-Təala bu malın əvəzini mənə versin. Hz. Peyğəmbər buyurdu: “Sizin bir-birinizdən olan fərqiniz kəlamınızın fərqi qədərdir. Əbu Aqil Ənsari bir “sa`” (1 sa`- 2,172 kq.) xurma gətirdi. Dedi: Ey peyğəmbər, iki “sa`” xurmam var idi, bir sa` gətirdim, bir sa` da ailəmdən ötrü saxladım”. Osman qoşuna lazım olan bütün şeylərin tədarükünü gördü, münafiqlər müsəlmanlara istehza edib deyirdilər: “Bu malları verməkdə məqsədləri riya və özlərini təriflətməkdir”. Allah-Təala bundan sonra qeyd olunan ayədə bu sözlərindən ötrü münafiqlərə əzab vədi verir).

**79) (الَّذِينَ يَلْمِزُونَ الْمُطَّوِّعِينَ مِنَ الْمُؤْمِنِينَ فِي الصَّدَقَاتِ) – o münafiqlər ki, möminlərdən ehsan edən şəxslərə sədəqə verdikləri üçün eyib tuturlar, (وَالَّذِينَ لَا يَجِدُونَ إِلَّا جُهْدَهُمْ) – Allah-Təala yolunda gücləri çatan şeyi sərf edən şəxslərə eyib tuturlar, (فَيَسْخَرُونَ مِنْهُمْ) – möminlərə istehza edirlər, (سَخِرَ اللهُ مِنْهُمْ وَلَهُمْ عَذَابٌ أَلِيمٌ) – Allah-Təala onların istehza etmələrinin əvəzini onlara verər və onlardan ötrü axirətdə şiddətli əzab vardır.** (Münafiqlərin başçısı Abdullah Übey naxoş oldu, həmin xəstəlikdən də həlak oldu, onun oğlu Abdullah mömin və saleh bir şəxs idi. Hz. Peyğəmbərdən Allahın atasını bağışlaması üçün dua etməsini istədi, Hz. Peyğəmbər də onun xahişinə görə dua etdi, o zaman növbəti ayə nazil oldu).

اسْتَغْفِرْ لَهُمْ أَوْ لَا تَسْتَغْفِرْ لَهُمْ إِنْ تَسْتَغْفِرْ لَهُمْ سَبْعِينَ مَرَّةً فَلَنْ يَغْفِرَ اللَّهُ لَهُمْ ذَلِكَ بِأَنَّهُمْ كَفَرُوا
بِاللَّهِ وَرَسُولِهِ وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ ﴿٨٠﴾ فَرِحَ الْمُخَلَّفُونَ بِمَقْعَدِهِمْ خِلَافَ رَسُولِ اللَّهِ
وَكَرِهُوا أَنْ يُجَاهِدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ فِي سَبِيلِ اللَّهِ وَقَالُوا لَا تَنْفِرُوا فِي الْحَرِّ قُلْ نَارُ جَهَنَّمَ أَشَدُّ
حَرًّا لَوْ كَانُوا يَفْقَهُونَ ﴿٨١﴾ فَلْيَضْحَكُوا قَلِيلًا وَلْيَبْكُوا كَثِيرًا جَزَاءً بِمَا كَانُوا يَكْسِبُونَ ﴿٨٢﴾ فَإِنْ
رَجَعَكَ اللَّهُ إِلَى طَائِفَةٍ مِنْهُمْ فَاسْتَأْذَنُوكَ لِلْخُرُوجِ فَقُلْ لَنْ تَخْرُجُوا مَعِيَ أَبَدًا

---

**80) (اسْتَغْفِرْ لَهُمْ أَوْ لَا تَسْتَغْفِرْ لَهُمْ)** – (ey Məhəmməd)**, münafiqlərin bağışlanmasını dilə, ya da diləmə, hər ikisi eynidir. (إِنْ تَسْتَغْفِرْ لَهُمْ سَبْعِينَ مَرَّةً فَلَنْ يَغْفِرَ اللَّهُ لَهُمْ) – əgər münafiqlərdən ötrü 70 dəfə də bağışlanma diləsən, Allah-Təala onları heç vaxt bağışlamayacaqdır.** (70 rəqəmi kinayə məqsədilədir, yəni onlardan ötrü nə qədər çox bağışlanma diləsən də, Allah-Təala onları bağışlamaz). **(ذَلِكَ بِأَنَّهُمْ كَفَرُوا بِاللَّهِ وَرَسُولِهِ) – Allah-Təalanın münafiqləri bağışlamamasının səbəbi odur ki, onlar Allah-Təalanı və onun peyğəmbərini inkar ediblər. (وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الْفَاسِقِينَ) – Allah-Təala fasiq olan münafiqləri xeyir əməl tərəfinə hidayət etməz, ilahi rəhmətə də layiq deyillər.**

**81) (فَرِحَ الْمُخَلَّفُونَ بِمَقْعَدِهِمْ خِلَافَ رَسُولِ اللَّهِ) – Təbük savaşında getməmək üçün Hz. Peyğəmbərdən izin alıb Mədinədə qalan münafiqlər, Allahın elçisi gedəndən sonra özlərinin Mədinədə qalmalarına sevindilər. (وَكَرِهُوا أَنْ يُجَاهِدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ فِي سَبِيلِ اللَّهِ) – Allah-Təala yolunda mal və canları ilə cihad etmək istəmədilər, (وَقَالُوا لَا تَنْفِرُوا فِي الْحَرِّ) – münafiqlər bir-birilərinin cihada getməsinə mane olub dedilər: "Havanın bu isti vaxtında savaşa** (Təbük savaşına) **getməyin". (قُلْ نَارُ جَهَنَّمَ أَشَدُّ حَرًّا)** – (ey Məhəmməd)**, onlara de ki, istidən özlərini qorusunlar, amma cəhənnəm odu dünyanın istiliyindən şiddətlidir. Gərək, ondan özlərini mühafizə etsinlər. Halbuki cihadı tərk etməklə özlərini cəhənnəm oduna daxil edirlər. (لَوْ كَانُوا يَفْقَهُونَ) – kaş agah olaydılar ki, cəhənnəm odu dünyanın istiliyindən şiddətlidir. O zaman özlərini qoruyardılar.** (Cahilliklərinin səbəbi özləridir. Allah-Təalanın sözünə qulaq assalar, məlumatları olardı).

**82) (فَلْيَضْحَكُوا قَلِيلًا) – münafiqlər qoy şad olub dünyada az bir zaman gülsünlər. (وَلْيَبْكُوا كَثِيرًا) – amma gərək, axirətdə də əbədi olaraq qəmgin olub ağlasınlar. (جَزَاءً بِمَا كَانُوا يَكْسِبُونَ) – axirətdə ağlamaları dünyada münafiq olub qazandıqları əməllərin cəzasıdır.**

**83) (فَإِنْ رَجَعَكَ اللَّهُ إِلَى طَائِفَةٍ مِنْهُمْ)** – (ey Məhəmməd)**, əgər Allah-Təala səni Mədinəyə o münafiqlərdən** (tövbə eyləməyib nifaq içində qalan) **bir dəstənin tərəfinə salamat qaytarsa, (فَاسْتَأْذَنُوكَ لِلْخُرُوجِ) – Mədinəyə qayıdandan sonra əgər bir də cihad olsa, o münafiqlər cihada getmək istəyib səndən izin istəsələr, (فَقُلْ لَنْ تَخْرُجُوا مَعِيَ أَبَدًا)** – (ey Məhəmməd)**, onlara de ki, sizə heç**

وَلَنْ تُقَاتِلُوا مَعِيَ عَدُوًّا إِنَّكُمْ رَضِيتُمْ بِالْقُعُودِ أَوَّلَ مَرَّةٍ فَاقْعُدُوا مَعَ الْخَالِفِينَ ﴿٨٣﴾ وَلَا تُصَلِّ عَلَى
أَحَدٍ مِنْهُمْ مَاتَ أَبَدًا وَلَا تَقُمْ عَلَى قَبْرِهِ إِنَّهُمْ كَفَرُوا بِاللَّهِ وَرَسُولِهِ وَمَاتُوا وَهُمْ فَاسِقُونَ ﴿٨٤﴾ وَلَا
تُعْجِبْكَ أَمْوَالُهُمْ وَأَوْلَادُهُمْ إِنَّمَا يُرِيدُ اللَّهُ أَنْ يُعَذِّبَهُمْ بِهَا فِي الدُّنْيَا وَتَزْهَقَ أَنْفُسُهُمْ وَهُمْ كَافِرُونَ
﴿٨٥﴾ وَإِذَا أُنْزِلَتْ سُورَةٌ أَنْ آمِنُوا بِاللَّهِ وَجَاهِدُوا مَعَ رَسُولِهِ اسْتَأْذَنَكَ أُولُو الطَّوْلِ مِنْهُمْ وَقَالُوا
ذَرْنَا نَكُنْ مَعَ الْقَاعِدِينَ ﴿٨٦﴾

---

**vaxt izin yoxdur, bundan sonra mənimlə birlikdə savaşa, ya da başqa yerə çıxmayın.** (وَلَنْ تُقَاتِلُوا مَعِيَ عَدُوًّا) – **mənə kömək etməyib, düşmənimlə heç vaxt savaşmayın. Bu barədə sizə izin verilməz.** (إِنَّكُمْ رَضِيتُمْ بِالْقُعُودِ أَوَّلَ مَرَّةٍ) – **həqiqətən, birinci dəfə** (Təbük savaşına gedəndə) **ki, siz münafiqlər Mədinədə oturub cihadı tərk etməyə razı olmuşdunuz, indi niyə savaşa getmək istəyirsiniz? Bundan sonra cihada getməyə sizə izin verilməz.** (فَاقْعُدُوا مَعَ الْخَالِفِينَ) – **Mədinədə qalan uşaqlar və qadınlarla oturun.** (Cihada getmək kişi xüsusiyyətidir, sizdə o xüsusiyyət yoxdur, sizə layiqdir ki, qadınların arasında qalıb onlar kimi olasınız).

**84)** (وَلَا تُصَلِّ عَلَى أَحَدٍ مِنْهُمْ مَاتَ أَبَدًا) – (ey Məhəmməd), **bir də heç vaxt münafiqlərdən biri öldüyündə namaz qılma. Bu hökm səndən ötrü həmişəlikdir.** (Peyğəmbərin barəsində olan hökm bütün ümmətdən ötrü də hökmdür). (وَلَا تَقُمْ عَلَى قَبْرِهِ) – **və heç bir münafiqin qəbrinin üstünə gedib, orada dayanma.** (إِنَّهُمْ كَفَرُوا بِاللَّهِ وَرَسُولِهِ) – **həqiqətən, münafiqlər Allah-Təalanı və onun peyğəmbərini inkar etdilər.** (وَمَاتُوا وَهُمْ فَاسِقُونَ) – **və tam nifaq içində öldülər. Belə olan halda sənin onlara namaz qılıb, qəbirlərinin üstünə gedib dayanman caiz deyildir.**

**85)** (وَلَا تُعْجِبْكَ أَمْوَالُهُمْ وَأَوْلَادُهُمْ) – (ey Məhəmməd), **onların mallarının və övladlarının çox olması səni təəccübləndirməsin.** (إِنَّمَا يُرِيدُ اللَّهُ أَنْ يُعَذِّبَهُمْ بِهَا فِي الدُّنْيَا) – **Allah-Təalanın istəyi odur ki, o mal və övlad səbəbi ilə münafiqlərə dünyada əzab etsin.** (Allah-Təala onları övladlarının həlak olmasına, mallarının tələf olmasına düçar edər. Bu, onlardan ötrü böyük əzabdır. Dünyada mal və övlad müsibətinə düçar olmaqdan böyük əzab olmaz. Necə ki zəngin münafiqlərdə bu hər bir zaman müşahidə olunur). (وَتَزْهَقَ أَنْفُسُهُمْ وَهُمْ كَافِرُونَ) – **Allah-Təalanın istəyi odur ki, münafiqlər mal və övladlarına məğrur olan halda, qalıb, kafir olduqları halda ruhları bədənlərindən çıxsın.**

**86)** (وَإِذَا أُنْزِلَتْ سُورَةٌ أَنْ آمِنُوا بِاللَّهِ وَجَاهِدُوا مَعَ رَسُولِهِ) – **elə ki Allah-Təaladan bir surə nazil olub, o surədə Allah-Təalaya möhkəm iman gətirmək və onun peyğəmbəri ilə** (Hz. Məhəmmədlə) **birlikdə cihad etmək əmr olundu,** (اسْتَأْذَنَكَ أُولُو الطَّوْلِ مِنْهُمْ) – (ey Məhəmməd), **belə vaxtda onlardan var-dövlət sahibi olanlar səndən izin istəyib** (وَقَالُوا ذَرْنَا نَكُنْ مَعَ الْقَاعِدِينَ) – **belə dedilər:**

رَضُوا بِأَنْ يَكُونُوا مَعَ الْخَوَالِفِ وَطُبِعَ عَلَى قُلُوبِهِمْ فَهُمْ لَا يَفْقَهُونَ ﴿٨٧﴾ لَكِنِ الرَّسُولُ وَالَّذِينَ
آمَنُوا مَعَهُ جَاهَدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ وَأُولَئِكَ لَهُمُ الْخَيْرَاتُ وَأُولَئِكَ هُمُ الْمُفْلِحُونَ ﴿٨٨﴾ أَعَدَّ
اللَّهُ لَهُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ ﴿٨٩﴾ وَجَاءَ الْمُعَذِّرُونَ
مِنَ الْأَعْرَابِ لِيُؤْذَنَ لَهُمْ وَقَعَدَ الَّذِينَ كَذَبُوا اللَّهَ وَرَسُولَهُ سَيُصِيبُ الَّذِينَ كَفَرُوا مِنْهُمْ عَذَابٌ أَلِيمٌ
﴿٩٠﴾ لَيْسَ عَلَى الضُّعَفَاءِ وَلَا عَلَى الْمَرْضَى وَلَا عَلَى الَّذِينَ لَا يَجِدُونَ مَا يُنْفِقُونَ حَرَجٌ

---

**“Bizi cihada aparma, burax bizi Mədinədə oturan şəxslərlə** (uşaqlar, qadınlar və xəstələrlə) **qalaq”.**

**87)** (رَضُوا بِأَنْ يَكُونُوا مَعَ الْخَوَالِفِ) – **nə qədər alçaq və əskik şəxslərdirlər, Mədinədə qalan qadınlar, uşaqlar və xəstələrlə özlərini bir tutmağa razı olurlar.** (وَطُبِعَ عَلَى قُلُوبِهِمْ فَهُمْ لَا يَفْقَهُونَ) – **onların qəlblərinə cəhalət səbəbi ilə möhür vurulubdur. Cihad etməkdə nə qədər səadət və savab, tərk etməkdə nə qədər asilik və əzab vardır, dərk etmirlər ki, üzrxahlıq edib, cihad etməkdən çəkinməsinlər.**

**88)** (لَكِنِ الرَّسُولُ وَالَّذِينَ آمَنُوا مَعَهُ جَاهَدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ) – **hərçənd münafiqlər cihada getməyib arxada qaldılar, amma peyğəmbər və onunla birlikdə Allah-Təalaya iman gətirənlər malları və canları ilə cihad etdilər.** (وَأُولَئِكَ لَهُمُ الْخَيْرَاتُ) – **bu cihada gedənlərdən ötrü dünya və axirət mənfəəti vardır.** (وَأُولَئِكَ هُمُ الْمُفْلِحُونَ) – **və qiyamət günündə nicat tapan şəxslər də bunlardır.**

**89)** (أَعَدَّ اللَّهُ لَهُمْ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا) – **Allah-Təala cihada gedənlərdən ötrü ağaclarının və qəsrlərinin altından çaylar axan bağlar hazır edibdir. Onlar o bağlarda həmişə qalıb, heç vaxt oradan çıxmayacaqlar,** (ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ) – **budur böyük əcr və savaba çatmaq,** (cihad edənlər buna qovuşacaqdır)**.**

**90)** (وَجَاءَ الْمُعَذِّرُونَ مِنَ الْأَعْرَابِ لِيُؤْذَنَ لَهُمْ) – (ey Məhəmməd), **bədəvi çöl ərəblərindən* bəziləri sənin hüzuruna gəlib üzrxahlıq etdilər ki, onlara izin verəsən ki, cihada getməsinlər.** (وَقَعَدَ الَّذِينَ كَذَبُوا اللَّهَ وَرَسُولَهُ) – **amma bədəvi çöl əhlindən Allah-Təalanı və onun peyğəmbərini təkzib edən bəziləri də cihada getməkdən imtina etdilər heç gəlib səndən izin də istəmədilər. Bundan məlum oldu ki, onlar yalandan iman gətirib, Allah-Təalanı və peyğəmbərini təkzib ediblər.** (سَيُصِيبُ الَّذِينَ كَفَرُوا مِنْهُمْ عَذَابٌ أَلِيمٌ) – **əlbəttə, bədəvi çöl əhlindən iman gətirəndən sonra kafir olub birdəfəlik imandan çıxanlara həm dünyada və həm də axirətdə şiddətli əzab üz verər.**

*(****Qeyd:** Bədəvi çöl ərəblərinə ‘‘ə`rabi’’ deyilir).*

**91)** (لَيْسَ عَلَى الضُّعَفَاءِ وَلَا عَلَى الْمَرْضَى وَلَا عَلَى الَّذِينَ لَا يَجِدُونَ مَا يُنْفِقُونَ حَرَجٌ) – **zəif şəxslərə** (bədənində taqəti olmayanlara), **naxoşlara və cihada getməyə**

إِذَا نَصَحُوا لِلَّهِ وَرَسُولِهِ مَا عَلَى الْمُحْسِنِينَ مِنْ سَبِيلٍ وَاللَّهُ غَفُورٌ رَحِيمٌ ﴿٩١﴾ وَلَا عَلَى الَّذِينَ إِذَا مَا أَتَوْكَ لِتَحْمِلَهُمْ قُلْتَ لَا أَجِدُ مَا أَحْمِلُكُمْ عَلَيْهِ تَوَلَّوْا وَأَعْيُنُهُمْ تَفِيضُ مِنَ الدَّمْعِ حَزَنًا أَلَّا يَجِدُوا مَا يُنْفِقُونَ ﴿٩٢﴾ إِنَّمَا السَّبِيلُ عَلَى الَّذِينَ يَسْتَأْذِنُونَكَ وَهُمْ أَغْنِيَاءُ رَضُوا بِأَنْ يَكُونُوا مَعَ الْخَوَالِفِ وَطَبَعَ اللَّهُ عَلَى قُلُوبِهِمْ فَهُمْ لَا يَعْلَمُونَ ﴿٩٣﴾ يَعْتَذِرُونَ إِلَيْكُمْ إِذَا رَجَعْتُمْ إِلَيْهِمْ قُلْ لَا تَعْتَذِرُوا لَنْ نُؤْمِنَ لَكُمْ قَدْ نَبَّأَنَا اللَّهُ مِنْ أَخْبَارِكُمْ وَسَيَرَى اللَّهُ عَمَلَكُمْ وَرَسُولُهُ

---

**xərclik tapmayanlara cihada hazır olmamaqda heç bir günah yoxdur,** (إِذَا نَصَحُوا لِلَّهِ وَرَسُولِهِ) – **əgər Allah-Təalaya və onun peyğəmbərinə iman gətirməkdə və onlara itaətdə sabit olmaqda xalqa nəsihət verən olsalar.** (مَا عَلَى الْمُحْسِنِينَ مِنْ سَبِيلٍ) – **üzrxahlığı olan yaxşı əməl sahiblərinə də cihada hazır olmadıqlarında heç bir məzəmmət və günah yolu yoxdur.** (وَاللَّهُ غَفُورٌ رَحِيمٌ) – **Allah-Təala yaxşı əməl sahiblərini bağışlayıb onlara rəhm edəndir.**

**92)** (وَلَا عَلَى الَّذِينَ إِذَا مَا أَتَوْكَ لِتَحْمِلَهُمْ) – **və yenə o yoxsul möminlərə günah yoxdur ki, (ey Məhəmməd, Təbük savaşına gedəndə) gəlib sənə dedilər: "Bizim miniyimiz yoxdur, savaşa getmək üçün bizi bir miniyə mindir ki, cihada gedək".** (قُلْتَ لَا أَجِدُ مَا أَحْمِلُكُمْ عَلَيْهِ) – (ey Məhəmməd), **sən onların cavabında dedin: "Sizi mindirməyə mən bir şey tapmıram".** (تَوَلَّوْا وَأَعْيُنُهُمْ تَفِيضُ مِنَ الدَّمْعِ حَزَنًا أَلَّا يَجِدُوا مَا يُنْفِقُونَ) – **elə ki minik tapmaqdan məyus oldular, dünya malından bir şey tapmayıb, savaşa tədarük görüb cihada gedə bilmədikləri üçün qəm-qüssədən gözlərindən yaş töküldüyü halda üz döndərib getdilər.**

**93)** (إِنَّمَا السَّبِيلُ عَلَى الَّذِينَ يَسْتَأْذِنُونَكَ وَهُمْ أَغْنِيَاءُ) – (ey Məhəmməd), **həqiqətən, məzəmmət və günah yolu o şəxslərə aiddir ki, Mədinədə qalmaq üçün səndən izin alırlar, halbuki özləri varlı olub və cihada getmək tədarükünə qadirdirlər.** (رَضُوا بِأَنْ يَكُونُوا مَعَ الْخَوَالِفِ) – **alçaq və əskik olduqlarından Mədinədə qalan qadınlar, uşaqlar və xəstələrlə qalıb onlardan sayılmağa razı oldular.** (وَطَبَعَ اللَّهُ عَلَى قُلُوبِهِمْ فَهُمْ لَا يَعْلَمُونَ) – **Allah-Təala onların nifaqlarına görə, qəlblərinə elə möhür vurubdur ki, heç vaxt cihadın fəzilətini və cihadı tərk etməyin günah və əzabını dərk edib agah olmazlar.**

**94)** (يَعْتَذِرُونَ إِلَيْكُمْ إِذَا رَجَعْتُمْ إِلَيْهِمْ) – (ey Məhəmməd), **elə ki Təbük savaşından qayıdıb Mədinəyə gəldiniz, cihada qadir olub getməyən münafiqlər arxada qaldıqları üçün gəlib sizdən üzr istəyərlər.** (قُلْ لَا تَعْتَذِرُوا لَنْ نُؤْمِنَ لَكُمْ) – (ey Məhəmməd), **onlara de ki, heç üzr istəməyin, heç vaxt sizin üzrxahlığınızı qəbul etmərik.** (قَدْ نَبَّأَنَا اللَّهُ مِنْ أَخْبَارِكُمْ) – **həqiqətən, sizin münafiq olub qəlbinizdə olan şər və fəsadları Allah-Təala bizə xəbər veribdir.** (وَسَيَرَى اللَّهُ عَمَلَكُمْ وَرَسُولُهُ) – **bundan sonra etdiyiniz əməllərinizə də Allah-Təala və onun peyğəmbəri agah olub görürlər.** (Yəni bilirlər ki, siz tövbə edib saleh əməl

ثُمَّ تُرَدُّونَ إِلَى عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ فَيُنَبِّئُكُم بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿٩٤﴾ سَيَحْلِفُونَ بِاللّٰهِ لَكُمْ إِذَا
انْقَلَبْتُمْ إِلَيْهِمْ لِتُعْرِضُوا عَنْهُمْ فَأَعْرِضُوا عَنْهُمْ إِنَّهُمْ رِجْسٌ وَمَأْوَاهُمْ جَهَنَّمُ جَزَاءً بِمَا كَانُوا يَكْسِبُونَ
﴿٩٥﴾ يَحْلِفُونَ لَكُمْ لِتَرْضَوْا عَنْهُمْ فَإِنْ تَرْضَوْا عَنْهُمْ فَإِنَّ اللّٰهَ لَا يَرْضَى عَنِ الْقَوْمِ الْفَاسِقِينَ ﴿٩٦﴾
الْأَعْرَابُ أَشَدُّ كُفْرًا وَنِفَاقًا وَأَجْدَرُ أَلَّا يَعْلَمُوا حُدُودَ مَا أَنْزَلَ اللّٰهُ عَلَى رَسُولِهِ وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ
﴿٩٧﴾ وَمِنَ الْأَعْرَابِ مَنْ يَتَّخِذُ مَا يُنْفِقُ مَغْرَمًا وَيَتَرَبَّصُ بِكُمُ الدَّوَائِرَ عَلَيْهِمْ دَائِرَةُ السَّوْءِ

---

edirsiniz, yoxsa yox?) **(ثُمَّ تُرَدُّونَ إِلَى عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ) – ölüm sizə gələndən sonra hər bir qeybə və aşkara agah olan Allah-Təala tərəfinə qaytarılarsınız. (فَيُنَبِّئُكُم بِمَا كُنْتُمْ تَعْمَلُونَ) – Allah-Təala dünyadakı əməllərinizi sizə xəbər verib o əməllərinizin cəzasını sizə yetirəcəkdir.**

**95) (سَيَحْلِفُونَ بِاللّٰهِ لَكُمْ إِذَا انْقَلَبْتُمْ إِلَيْهِمْ لِتُعْرِضُوا عَنْهُمْ)** – (ey Məhəmməd)**, elə ki siz Təbük savaşından qayıdıb Mədinəyə gəldiniz, münafiqlər arxada qaldıqları üçün sizdən üzr istəyib and içirlər ki, onlardan üz döndərib onları məzəmmət etməyəsiniz. (فَأَعْرِضُوا عَنْهُمْ إِنَّهُمْ رِجْسٌ) – siz də onlardan üz döndərib, onları məzəmmət etməyin. Məzəmmət o şəxsə fayda verər ki, imanı olub günahkar olsun. Amma bu münafiqlər nəcis və murdardırlar** (məzəmmət etməklə pak olmazlar), **(وَمَأْوَاهُمْ جَهَنَّمُ) – onların məskənləri cəhənnəmdir. (جَزَاءً بِمَا كَانُوا يَكْسِبُونَ) – dünyada qazandıqları əməlləri səbəbi ilə onlara cəhənnəm cəzası verilər.**

**96) (يَحْلِفُونَ لَكُمْ لِتَرْضَوْا عَنْهُمْ)** – (ey Məhəmməd)**, münafiqlər sizdən ötrü and içirlər ki, onlardan razı olasınız. (فَإِنْ تَرْضَوْا عَنْهُمْ) – əgər siz o münafiqlərdən razı olsanız, (فَإِنَّ اللّٰهَ لَا يَرْضَى عَنِ الْقَوْمِ الْفَاسِقِينَ) – sizin razı olmağınız onlara bir fayda verməz, həqiqətən, Allah-Təala fasiq münafiqlərdən razı olan deyildir.**

**97) (الْأَعْرَابُ أَشَدُّ كُفْرًا وَنِفَاقًا) – çöldə olan kafirlər küfr və nifaqlarında şəhərdə olan kafir və münafiqlərdən daha möhkəmdirlər.** (Çöl əhli elm və mərifətdən uzaq olduğu üçün daha sərt və vəhşi olarlar). **(وَأَجْدَرُ أَلَّا يَعْلَمُوا حُدُودَ مَا أَنْزَلَ اللّٰهُ عَلَى رَسُولِهِ) – Allah-Təalanın peyğəmbərinə göndərdiyi hökmlərə agah olmamağa çöl əhli daha layiqdir, çünki elm və mərifətdən uzaqdırlar. Amma siz şəhər əhlinin içində münafiqlər az deyil. (وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ) – Allah-Təala çöl və şəhər əhlindən hər bir şəxsin əhvalına agahdır, hikmət üzrə onların yaxşılarına savab verib pislərinə cəza verər.**

**98) (وَمِنَ الْأَعْرَابِ مَنْ يَتَّخِذُ مَا يُنْفِقُ مَغْرَمًا) – çöl əhlindən bəzi şəxslər vardır ki, Allah-Təala və islam yolunda sərf etdiyi malını özündən ötrü zərər hesab edir. Çünki o malı naəlaclıqdan riya üçün sərf edər. (وَيَتَرَبَّصُ بِكُمُ الدَّوَائِرَ) – gözləyir ki, zəmanə dövr edib, sizə bir müsibət və bəla varid olsun. (عَلَيْهِمْ دَائِرَةُ السَّوْءِ) – zəmanənin müsibəti o münafiqlərin özlərinə varid**

وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ ﴿٩٨﴾ وَمِنَ الْأَعْرَابِ مَنْ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ وَيَتَّخِذُ مَا يُنْفِقُ قُرُبَاتٍ عِنْدَ اللَّهِ وَصَلَوَاتِ الرَّسُولِ أَلَا إِنَّهَا قُرْبَةٌ لَهُمْ سَيُدْخِلُهُمُ اللَّهُ فِي رَحْمَتِهِ إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ ﴿٩٩﴾ وَالسَّابِقُونَ الْأَوَّلُونَ مِنَ الْمُهَاجِرِينَ وَالْأَنْصَارِ وَالَّذِينَ اتَّبَعُوهُمْ بِإِحْسَانٍ رَضِيَ اللَّهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ وَأَعَدَّ لَهُمْ جَنَّاتٍ تَجْرِي تَحْتَهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ ﴿١٠٠﴾

---

**olsun.** (Allah-Təala münafiqlərə bəd dua edir). **(وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ) – Allah-Təala münafiqlərin danışdığı sözləri eşidib onların qəlblərinə agahdır.**

**99) (وَمِنَ الْأَعْرَابِ مَنْ يُؤْمِنُ بِاللَّهِ وَالْيَوْمِ الْآخِرِ) – çöl əhlindən bəzi şəxslər vardır ki, Allah-Təalaya və axirət gününə iman gətirib, (وَيَتَّخِذُ مَا يُنْفِقُ قُرُبَاتٍ عِنْدَ اللَّهِ وَصَلَوَاتِ الرَّسُولِ) – Allah-Təala yolunda sərf etdiyi malını Allah-Təalaya yaxın olmağa və peyğəmbərin onun üçün dua etməsinə səbəb sayar.** (Hz. Peyğəmbər zəkat və sədəqə verən şəxslər üçün dua edərdi. Necə ki bundan sonra gələn ayədə qeyd olunur). **(أَلَا إِنَّهَا قُرْبَةٌ لَهُمْ سَيُدْخِلُهُمُ اللَّهُ فِي رَحْمَتِهِ) – əlbəttə, sədəqə öz sahibləri üçün Allah-Təalaya yaxınlıq səbəbidir, Allah-Təala onları qiyamət günündə öz rəhmətinə daxil edər. (إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ) – həqiqətən, Allah-Təala onun yolunda ehsan edən şəxsləri bağışlayıb onlara rəhm edəndir.**

**100) (وَالسَّابِقُونَ الْأَوَّلُونَ مِنَ الْمُهَاجِرِينَ وَالْأَنْصَارِ) – islamın zühuru zamanı ilk iman* edən şəxslərdən** (mühacirlərdən və ənsardan), **(وَالَّذِينَ اتَّبَعُوهُمْ بِإِحْسَانٍ) – və ilk iman gətirənlərə gözəl şəkildə tabe olub iman gətirən şəxslərdən, (رَضِيَ اللَّهُ عَنْهُمْ وَرَضُوا عَنْهُ) – onların yaxşı və gözəl əməllərinə görə, Allah-Təala hamısından razı oldu, bu səbəbdən Allah-Təala onlara verdiyi din və dünya nemətlərini bol etdi. Onlar da Allah-Təaladan razı oldular. (وَأَعَدَّ لَهُمْ جَنَّاتٍ تَجْرِي تَحْتَهَا الْأَنْهَارُ خَالِدِينَ فِيهَا أَبَدًا) – Allah-Təala onlardan ötrü axirətdə ağaclarının və qəsrlərinin altından çaylar axan bağlar hazırlayıbdır, o bağlarda həmişə qalıb heç vaxt oradan çıxmayacaqlar. (ذَلِكَ الْفَوْزُ الْعَظِيمُ) – böyük əcr və savaba yetişmək budur.**

*(****Qeyd:** Məkkə əhlindən ilk iman gətirən Hz. Xədicə, ondan sonra Əli ibn Əbu Talib, ondan sonra Zeyd ibn Harisə, 4-cü Əbu Bəkirdir. Əbu Bəkirin dəvətiylə islama daxil olanlar bunlardır: Osman ibn Əffan, Zübeyr ibnül-Əvvam, Əbdürrəhman ibn Əfv, Sə`d ibn Əbu Vəqqas, Təlhə ibn Abdullah. Ənsardan ilk iman edənlər - Hz. Peyğəmbər Məkkədə olan zaman Mədinədən gəlib Məkkədən kənarda gecə vaxtı Hz. Peyğəmbərə iman gətirib qayıdıb Mədinəyə gedənlərdir. Onlar 3 ayrı vaxtda 3 dəstə halında gəlib Hz. Peyğəmbərə Məkkədə beyət etdilər. İlk dəstə 7 nəfərdən ibarət idi. İkinci dəstə - 12 nəfər, 3-cü dəstə 70 nəfər idi. Ənsardan ilk iman gətirənlər bunlardır. Onların hamısını qeyd etmək çox vaxt aparar. Allah onların hamısından razı olsun).*

وَمِمَّنْ حَوْلَكُمْ مِنَ الْأَعْرَابِ مُنَافِقُونَ وَمِنْ أَهْلِ الْمَدِينَةِ مَرَدُوا عَلَى النِّفَاقِ لَا تَعْلَمُهُمْ نَحْنُ نَعْلَمُهُمْ سَنُعَذِّبُهُمْ مَرَّتَيْنِ ثُمَّ يُرَدُّونَ إِلَى عَذَابٍ عَظِيمٍ ﴿١٠١﴾ وَآخَرُونَ اعْتَرَفُوا بِذُنُوبِهِمْ خَلَطُوا عَمَلًا صَالِحًا وَآخَرَ سَيِّئًا عَسَى اللَّهُ أَنْ يَتُوبَ عَلَيْهِمْ إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ ﴿١٠٢﴾ خُذْ مِنْ أَمْوَالِهِمْ صَدَقَةً تُطَهِّرُهُمْ وَتُزَكِّيهِمْ بِهَا

---

**101) (وَمِمَّنْ حَوْلَكُمْ مِنَ الْأَعْرَابِ مُنَافِقُونَ وَمِنْ أَهْلِ الْمَدِينَةِ)** - (ey Məhəmməd)**, sizin bu Mədinə şəhərinin ətrafında olan çöl əhlindən** (Cüheynə, Əsləm, Əşca və Qifar qəbilələrindən) **münafiq olan camaatlar vardır. Habelə Mədinə əhlindən də münafiqlər vardırlar. (مَرَدُوا عَلَى النِّفَاقِ)** - **nifaqda son dərəcə mahirdirlər, (لَا تَعْلَمُهُمْ)** - (ey Məhəmməd)**, sən o münafiqlərdən agah deyilsən, (نَحْنُ نَعْلَمُهُمْ)** - **biz onlardan agahıq. (سَنُعَذِّبُهُمْ مَرَّتَيْنِ)** - **əlbəttə, onlara dünyada iki dəfə əzab edərik,** (mallarını əskildib, canlarına bəla verərik). **(ثُمَّ يُرَدُّونَ إِلَى عَذَابٍ عَظِيمٍ)** - **ondan sonra ölüm onlara gəlib, axirətdə böyük əzab tərəfinə qaytarılarlar.** (Təbük savaşına getməyən üç nəfər - 1-Əbu Lübabə, 2-Evs ibn Sələbə, 3-Vədiə ibn Hizam Hz. Peyğəmbər Təbük savaşına gedəndən sonra onlarla birlikdə getmədiklərinə peşman oldular. Elə ki Hz. Peyğəmbərin savaşdan qayıtdığını eşitdilər, özlərini məscidin sütununa bağladılar. Hz. Peyğəmbər gəlib, məscidə daxil olub, iki rükət namaz qıldı. Hz. Peyğəmbərin adəti bu idi, hər dəfə səfərdən qayıdıb gələndə əvvəlcə məscidə daxil olub iki rükət namaz qılardı. Ondan sonra o 3 nəfərin əhvalatını xəbər aldı. Dedilər: "Bunlar and içiblər ki, sən onları bağışlayıb açmayana qədər özlərini açmasınlar". Hz. Peyğəmbər buyurdu: "Allah-Təala onların barəsində hökm nazil edənə qədər mən onları açmaram". O vaxt bundan sonra gələn ayə nazil oldu. Hz. Peyğəmbər onları sütundan açdı. Onlar dedilər: "Ey Peyğəmbər, biz mallarımızı səndən əsirgədik, indi necə istəyirsən et, bu malları Allah-Təala yolunda sərf edib bizi pak et". Hz. Peyğəmbər buyurdu: "Bu barədə mən Allah-Təala tərəfindən bir şeylə vəzifələndirilməmişəm". Ondan sonra ikinci ayə nazil oldu, o ayələr bunlardır:)

**102) (وَآخَرُونَ اعْتَرَفُوا بِذُنُوبِهِمْ)** - **Təbükdən qalanlardan bir neçə nəfər** (qeyd olunan bu 3 nəfər) **vardır ki, öz günahlarını etiraf etdilər,** (özlərini sütuna bağladılar), **(خَلَطُوا عَمَلًا صَالِحًا وَآخَرَ سَيِّئًا) - saleh əməllə günahı bir-birinə qarışdırdılar. (عَسَى اللَّهُ أَنْ يَتُوبَ عَلَيْهِمْ)** - **əlbəttə, tövbə edəndən sonra Allah-Təala onların tövbəsini qəbul edər. (إِنَّ اللَّهَ غَفُورٌ رَحِيمٌ)** - **həqiqətən, Allah-Təala tövbə edən şəxsləri bağışlayıb rəhm edəndir.**

**103) (خُذْ مِنْ أَمْوَالِهِمْ صَدَقَةً تُطَهِّرُهُمْ وَتُزَكِّيهِمْ بِهَا)** - (ey Məhəmməd)**, o 3 nəfər ki, mallarını gətirib Allah-Təala yolunda sərf etməyi səndən xahiş etdilər, o malların hamısını sərf etmək lazım deyildir. Onların və onlardan başqasının malından zəkat al ki, o zəkat səbəbinə onları hər bir günahdan pak**

وَصَلِّ عَلَيْهِمْ إِنَّ صَلَاتَكَ سَكَنٌ لَهُمْ وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ ﴿١٠٣﴾ أَلَمْ يَعْلَمُوا أَنَّ اللَّهَ هُوَ يَقْبَلُ التَّوْبَةَ
عَنْ عِبَادِهِ وَيَأْخُذُ الصَّدَقَاتِ وَأَنَّ اللَّهَ هُوَ التَّوَّابُ الرَّحِيمُ ﴿١٠٤﴾ وَقُلِ اعْمَلُوا فَسَيَرَى اللَّهُ عَمَلَكُمْ
وَرَسُولُهُ وَالْمُؤْمِنُونَ وَسَتُرَدُّونَ إِلَى عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ ﴿١٠٥﴾
وَآخَرُونَ مُرْجَوْنَ لِأَمْرِ اللَّهِ إِمَّا يُعَذِّبُهُمْ وَإِمَّا يَتُوبُ عَلَيْهِمْ وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿١٠٦﴾

---

**və təmiz edəsən. (وَصَلِّ عَلَيْهِمْ إِنَّ صَلَاتَكَ سَكَنٌ لَهُمْ)** – (ey Məhəmməd), **zəkat alan zaman onlara dua elə. Həqiqətən, sənin dua etməyin onların qəlblərinin rahatlamasına səbəb et.** (Bu ayə buna dəlildir ki, hər bir sədəqə verib ehsan edən şəxsə dua edib razılıq etmək lazımdır). **(وَاللَّهُ سَمِيعٌ عَلِيمٌ) – və Allah-Təala onların tövbəsini eşidib qəlblərindən agahdır, bilir ki, həqiqətən, tövbə ediblər, yoxsa yox?**

**104) (أَلَمْ يَعْلَمُوا أَنَّ اللَّهَ هُوَ يَقْبَلُ التَّوْبَةَ عَنْ عِبَادِهِ) – bəs bu tövbə edən şəxslər bilmirlər ki,** (ixlaslı qəlb ilə tövbə etsələr), **həqiqətən, Allah-Təala öz bəndələrindən tövbəni qəbul edər? (وَيَأْخُذُ الصَّدَقَاتِ)** – (bilmirlər ki,) **Allah-Təala onların malından zəkat alar? Zəkatı vacib edən Allah-Təaladır. (وَأَنَّ اللَّهَ هُوَ التَّوَّابُ الرَّحِيمُ)** – (və bilmirlər ki,) **həqiqətən, tövbəni qəbul edib öz bəndələrinə rəhm edən Allah-Təaladır?**

**105) (وَقُلِ اعْمَلُوا)** – (ey Məhəmməd), **münafiqlərə de ki, nə əməl istəyirsinizsə, edin. (فَسَيَرَى اللَّهُ عَمَلَكُمْ وَرَسُولُهُ وَالْمُؤْمِنُونَ) – sizin heç bir əməliniz məxfi qalmaz, Allah-Təala, onun peyğəmbəri və möminlər sizin əməllərinizdən agah olub görürlər. (وَسَتُرَدُّونَ إِلَى عَالِمِ الْغَيْبِ وَالشَّهَادَةِ) – və ondan sonra ölüm sizə gəlib, qeybə və aşkara agah olan Allah-Təala tərəfinə qaytarılarsınız. (فَيُنَبِّئُكُمْ بِمَا كُنْتُمْ تَعْمَلُونَ) – dünyada etdiyiniz əməllərinizi sizə xəbər verib, onların cəzasını sizə verər.**

**106) (وَآخَرُونَ مُرْجَوْنَ لِأَمْرِ اللَّهِ) – başqa bir camaatın** (Təbük savaşına getməyən münafiqlər) **işi naməlum olub, Allah-Təalanın ixtiyarına qalıbdır. (إِمَّا يُعَذِّبُهُمْ وَإِمَّا يَتُوبُ عَلَيْهِمْ) – ya onlara əzab edər, (əgər günahlarına davam edib, tövbə etməsələr), ya da tövbələrini qəbul edib günahlarından keçər** (əgər tövbə etsələr), **(وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ) – Allah-Təala bütün məxluqatın əhvalına agahdır, tövbə edənlərə hikmət üzrə savab verib, tövbə etməyənlərə əzab edər.** (elə ki Hz. Peyğəmbər hicrətin əvvəlində Mədinəyə gəldi, Mədinədən kənar bəni-Əmr və İbn Əvf məhəlləsində Quba məscidini tikib, orada namaz qıldı. O camaatın hamısı iman edib, mənən və maddi tərəqqi etdilər. Onların yaxınlığında onlarla bir nəsildən olan bəni-Ğunm ibn Əfv camaatı yəhudi dinindən idilər. Onların rəisi olan rahib Əbu Amir Hz. Peyğəmbərlə düşmənçilik etdi. Məkkə əhlinin Hz. Peyğəmbərlə olan savaşlarının hamısında Əbu Amir Məkkə əhlinə kömək edib, Hz. Peyğəmbərə qarşı savaşdı. Hz. Peyğəmbər Məkkə əhlinə qalib gələndə Əbu Amir qaçıb Şama getdi. İstəyirdi

وَالَّذِينَ اتَّخَذُوا مَسْجِدًا ضِرَارًا وَكُفْرًا وَتَفْرِيقًا بَيْنَ الْمُؤْمِنِينَ وَإِرْصَادًا لِمَنْ حَارَبَ اللَّهَ وَرَسُولَهُ مِنْ قَبْلُ

---

Rum qeysərinin yanına gedib ondan kömək alıb gəlsin, Hz. Peyğəmbəri qətlə yetirib Mədinəni xarab etsin. Bəni-Ğunm ibn Əfv camaatı bir məscid tikdilər və müsəlmanlıqlarını izhar edib, küfr və nifaqlarını gizlətdilər. Fikirləri bu idi ki, Hz. Peyğəmbəri gətirsinlər, o məsciddə namaz qılsın, ondan sonra Əbu Amiri Şamdan gətirsinlər, qədim dinlərini aşkar edib Əbu Amirlə o məsciddə öz dinlərinə görə namaz qılsınlar və bu səbəbdən Quba məscidinin fəzilətini batil edib, müsəlmanlara desinlər ki, sizin məscidin bir fəziləti yoxdur, biz özümüz yəhudiyik, amma sizin peyğəmbər bizim məsciddə namaz qıldı. Bu sözlə müsəlmanların arasına ixtilaf salmaq istəyirdilər. Hz. Peyğəmbərin hüzuruna gəlib xahiş etdilər: "Ey Peyğəmbər, bizim məscidə gəlib namaz qıl". Hz. Peyğəmbər buyurdu: "Mən səfər tədarükü ilə məşğulam, (bu əhvalat Təbük savaşına gedən zaman baş verdi), səfərdən qayıdanda gəlib sizin məsciddə namaz qılaram". Hz. Peyğəmbər Təbük savaşından qayıdanda, istədi gedib o məsciddə namaz qılsın, sıradakı ayə nazil olub, Hz. Peyğəmbərin orada namaz qılmasını qadağan etdi, çünki o camaatın məscid tikməkdə məqsədi müsəlmanların arasına təfriqə salmaq idi. O məscidin əsası Allah-Təala rizası üçün qoyulmayıbdır. Bəlkə, küfr və nifaq üzrə qoyulubdur. Necə ki ayədə bəyan edilir).

**107) (وَالَّذِينَ اتَّخَذُوا مَسْجِدًا ضِرَارًا وَكُفْرًا وَتَفْرِيقًا بَيْنَ الْمُؤْمِنِينَ)** – (ey Məhəmməd), **bu şəxslərin** (bəni-Ğunm ibn Əfv camaatının) **məscid tikməkdə məqsədi müsəlmanlara zərər,* küfr və nifaqa qüvvət verib, möminlərin arasına təfriqə salmaqdır.** (İstəyirdilər ki, Quba əhli - bizim məscidin fəziləti vardır, çünki Hz. Peyğəmbər burada namaz qılıb, dediklərində, onlar da belə cavab versinlər: "O məscidin fəziləti yoxdur, əgər olsaydı, bizim məscidimizdə namaz qılmazdı, halbuki biz onun dininə daxil olmamışıq").

*(***Qeyd:** bu ayə buna işarə edir ki, riya və öyünmək üçün, ya da Allah-Təalaya ibadətdən başqa, bir məqsəd üçün tikilən hər bir məscid Dirar məscidi kimidir. Ömər ibn Xəttab öz xilafəti zamanında əmr verdi ki, müsəlmanlar fəth etdikləri şəhərlərdə məscidlər tiksinlər, amma hansı məscidin tikilməsi o biri məscidin əhlinə zərər versə, o məscid tikilməsin. Bizim bu dövrdə hər bir şəhərdə və kəndlərdə tikilən saysız-hesabsız məscidlərin əksəriyyəti ibadətdən ötrü tikilməyib, hamısı yalançıların yalan sözlərinə qulaq asmaqdan ötrü tikilibdir. Aşura günlərində əhli-beytin (ruhlarına fəda olum) müsibəti bəhanəsiylə o məscidlərdə danışılan yalan sözləri, o məscidlərdə cahillərin etdiyi qəbih əməlləri, vəhşicəsinə səslərlə fəryad edib o həzrətlərin pak ruhlarına əziyyət etdiklərini düşünəndə bu məscidlərin nəinki Dirar məscidindən, bəlkə, bütxanalardan da betər olduğu aydın olar).*

**(وَإِرْصَادًا لِمَنْ حَارَبَ اللَّهَ وَرَسُولَهُ مِنْ قَبْلُ)** – **məscidi tikəndən sonra o şəxsi** (rahib Əbu Amir) **gözləməyə başladılar ki, hansı ki bundan əvvəl Mədinədə**

وَلَيَحْلِفُنَّ إِنْ أَرَدْنَا إِلَّا الْحُسْنَى وَاللَّهُ يَشْهَدُ إِنَّهُمْ لَكَاذِبُونَ ﴿١٠٧﴾ لَا تَقُمْ فِيهِ أَبَدًا لَمَسْجِدٌ أُسِّسَ
عَلَى التَّقْوَى مِنْ أَوَّلِ يَوْمٍ أَحَقُّ أَنْ تَقُومَ فِيهِ فِيهِ رِجَالٌ يُحِبُّونَ أَنْ يَتَطَهَّرُوا وَاللَّهُ يُحِبُّ الْمُطَّهِّرِينَ
﴿١٠٨﴾ أَفَمَنْ أَسَّسَ بُنْيَانَهُ عَلَى تَقْوَى مِنَ اللَّهِ وَرِضْوَانٍ خَيْرٌ أَمْ مَنْ أَسَّسَ بُنْيَانَهُ عَلَى شَفَا جُرُفٍ
هَارٍ فَانْهَارَ بِهِ فِي نَارِ جَهَنَّمَ وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ ﴿١٠٩﴾ لَا يَزَالُ بُنْيَانُهُمُ الَّذِي بَنَوْا رِيبَةً
فِي قُلُوبِهِمْ إِلَّا أَنْ تَقَطَّعَ قُلُوبُهُمْ

---

**olanda Allah-Təala ilə və onun peyğəmbəriylə müharibə eləmişdi.** (Onu gözləyirdilər ki, Rum qeysərindən kömək alıb, gəlsin Mədinəni xarab etsin, Hz. Peyğəmbəri qətlə yetirib o məsciddə namaz qılsın). **(وَلَيَحْلِفُنَّ إِنْ أَرَدْنَا إِلَّا الْحُسْنَى) - and içirlər ki, biz bu məscidi tikməklə orada namaz qılıb Allah-Təalaya ibadət etməkdən başqa bir şey istəməmişik. (وَاللَّهُ يَشْهَدُ إِنَّهُمْ لَكَاذِبُونَ) – amma Allah-Təala şəhadət edir ki, onlar bu sözlərində yalançıdırlar.** (O məscidin əsası zərər və ixtilaf salmaqdan ötrü qoyulubdur)**.**

**108) (لَا تَقُمْ فِيهِ أَبَدًا)** - (ey Məhəmməd)**, heç vaxt o məscidə daxil olub, namaz qılma, (لَمَسْجِدٌ أُسِّسَ عَلَى التَّقْوَى مِنْ أَوَّلِ يَوْمٍ أَحَقُّ أَنْ تَقُومَ فِيهِ)** - (ey Məhəmməd), **əlbəttə, o məscid ki** (Quba məscidi) **onun binası ilk gündən təqva üzərinə qurulubdur, belə məscid layiqir ki, oraya daxil olub orada durub namaz qılasan,** (nəinki Dirar məscidində), **(فِيهِ رِجَالٌ يُحِبُّونَ أَنْ يَتَطَهَّرُوا) - Quba məscidində kişilər var ki, namaz vaxtı hər bir nəcasətdən pak olmaq istərlər. (وَاللَّهُ يُحِبُّ الْمُطَّهِّرِينَ) – Allah-Təala da pak və təmiz şəxsləri sevər.**

**109) (أَفَمَنْ أَسَّسَ بُنْيَانَهُ عَلَى تَقْوَى مِنَ اللَّهِ وَرِضْوَانٍ خَيْرٌ) – bəs öz dininin binasını Allah-Təalanın razılığı və təqva üzərinə möhkəm edən şəxs yaxşıdır? (أَمْ مَنْ أَسَّسَ بُنْيَانَهُ عَلَى شَفَا جُرُفٍ هَارٍ) – yoxsa binasını sel sularının altını qazıb, az qala yıxıb məhv edəcəyi bir yerin kənarında quran o şəxs yaxşıdır? (فَانْهَارَ بِهِ فِي نَارِ جَهَنَّمَ) – hansı ki yıxılmaqla öz sahibini də cəhənnəm oduna salar.** (Hansı yaxşıdır? Allah-Təala dini möhkəm olmayan şəxsi, münafiqi sel sularının kənarında bina tikən şəxsə oxşadır, necə ki bu binanın özülü yoxdur, habelə o münafiqin də dininin əsası yoxdur)**. (وَاللَّهُ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ) - Allah-Təala zalım camaatı haqq tərəfinə hidayət etməz.** (Bu ayə Quba məscidi ilə Dirar məscidindən ötrü məsəldir. Yəni Quba məscidinin binası təqva üzərinə qurulub və Allah-Təala ondan razıdır, bu səbəbdən də onun sahibləri nicat tapan şəxslərdir. Amma Dirar məscidinin binası küfr və nifaq üzərinə qurulduğundan sahibləri cəhənnəmə daxil olub, onların əzab görmələrinə bais olar).

**110) ( لَا يَزَالُ بُنْيَانُهُمُ الَّذِي بَنَوْا رِيبَةً فِي قُلُوبِهِمْ) – onların qurduqları bina** (məscid) **qəlblərindəki şəkk və nifaqı artırar. Nifaqdan kənar olmazlar. (إِلَّا أَنْ تَقَطَّعَ قُلُوبُهُمْ) – ancaq qəlbləri parça-parça olub dağıldığında, qəlblərindən şəkk və nifaq çıxar.** (Yəni nə qədər ki münafiqlərin qəlbləri sağ-salamatdır, şəkk

وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ ﴿١١٠﴾ إِنَّ اللَّهَ اشْتَرَى مِنَ الْمُؤْمِنِينَ أَنْفُسَهُمْ وَأَمْوَالَهُمْ بِأَنَّ لَهُمُ الْجَنَّةَ يُقَاتِلُونَ
فِي سَبِيلِ اللَّهِ فَيَقْتُلُونَ وَيُقْتَلُونَ وَعْدًا عَلَيْهِ حَقًّا فِي التَّوْرَاةِ وَالْإِنْجِيلِ وَالْقُرْآنِ وَمَنْ أَوْفَى بِعَهْدِهِ
مِنَ اللَّهِ فَاسْتَبْشِرُوا بِبَيْعِكُمُ الَّذِي بَايَعْتُمْ بِهِ وَذَلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ ﴿١١١﴾ التَّائِبُونَ الْعَابِدُونَ
الْحَامِدُونَ السَّائِحُونَ الرَّاكِعُونَ السَّاجِدُونَ الْآمِرُونَ بِالْمَعْرُوفِ وَالنَّاهُونَ عَنِ الْمُنْكَرِ وَالْحَافِظُونَ
لِحُدُودِ اللَّهِ وَبَشِّرِ الْمُؤْمِنِينَ ﴿١١٢﴾

---

və nifaqdan əsla uzaq olmaz. Öldüklərində isə qəlbləri ölüm səbəbi ilə parçalanacağı üçün, şəkk və nifaqdan təmizlənmiş olarlar). **(وَاللَّهُ عَلِيمٌ حَكِيمٌ) – Allah-Təala bütün məxluqatın əhvalından agahdır və münafiqlərin barəsində hikmət üzrə hökm edər.**

**111) (إِنَّ اللَّهَ اشْتَرَى مِنَ الْمُؤْمِنِينَ أَنْفُسَهُمْ وَأَمْوَالَهُمْ بِأَنَّ لَهُمُ الْجَنَّةَ) – həqiqətən, Allah-Təala cihad edən möminlərdən canlarını və mallarını alar ki, əvəzində onlara cənnət versin.** (Necə ki alış-verişdə bir şey alanda gərək onun əvəzində bir şey verilsin. Axirət alış-verişi də belədir, Allah-Təala yolunda can və malından keçən şəxsə Haqq-Təala əvəzində cənnət verər. **(يُقَاتِلُونَ فِي سَبِيلِ اللَّهِ) – bunun səbəbi odur ki, Allah-Təala yolunda cihad edərlər. (فَيَقْتُلُونَ وَيُقْتَلُونَ) – cihad etməklə, ya düşməni qətlə yetirərlər, ya da özləri öldürülərlər. Hər iki halda da əvəzində Allah-Təala onlara cənnəti verər. (وَعْدًا عَلَيْهِ حَقًّا فِي التَّوْرَاةِ وَالْإِنْجِيلِ وَالْقُرْآنِ) – Allah-Təalanın cihad edənlərə verdiyi vəd Tövrat, İncil və Quranda sabitdir, gərək, vədinə vəfa etsin. (وَمَنْ أَوْفَى بِعَهْدِهِ مِنَ اللَّهِ) – Allah-Təaladan artıq əhdinə vəfa edən kimdir? (فَاسْتَبْشِرُوا بِبَيْعِكُمُ الَّذِي بَايَعْتُمْ بِهِ)** – (ey möminlər)**, Allah-Təala ilə etdiyiniz bu alış-verişinizə müjdə olsun,** (bundan artıq alış-veriş olmaz), **(وَذَلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ) – bu alış-veriş böyük savaba qovuşmaqdır.**

**112) (التَّائِبُونَ)** – (bu ayədə möminlərin xüsusiyyətləri bəyan olunur)**, günahlarından tövbə edənlər, (الْعَابِدُونَ) – Allah-Təalaya ixlasla ibadət edənlər, (الْحَامِدُونَ) – hər bir məqamda Allah-Təalaya həmd-səna edənlər, (السَّائِحُونَ) – zəhmət çəkib elm dalınca gedib təhsil alanlar,** (mömin şəxsin böyük xüsusiyyəti elm sahibi olmasıdır)**, (الرَّاكِعُونَ السَّاجِدُونَ) – namaz qılıb, rüku və səcdə edənlər, (الْآمِرُونَ بِالْمَعْرُوفِ) – yaxşı, gözəl şeyləri əmr edənlər, (وَالنَّاهُونَ عَنِ الْمُنْكَرِ) – pis əməlləri qadağan edənlər, (وَالْحَافِظُونَ لِحُدُودِ اللَّهِ) – Allah-Təalanın vacib hökmlərini mühafizə edənlər** (möminlərdir)**, (وَبَشِّرِ الْمُؤْمِنِينَ) –** (ey Məhəmməd)**, bu xüsusiyyətlərin sahibi olan möminləri Allah-Təalanın rəhməti və bağışlaması ilə müjdələ,** (Hz. Peyğəmbərə xəbər verdilər ki, filan mömin şəxs müşrik ata-babalarının Allahdan bağışlanmasını diləyir. Hz. Peyğəmbər buyurdu: "Biz də onlar üçün Allahdan bağışlanma diləyərik". O zaman növbəti ayə nazil oldu). Zəməxşəri "Kəşşaf"da yazır: "Hz. Peyğəmbər

**مَا كَانَ لِلنَّبِيِّ وَالَّذِينَ آمَنُوا أَنْ يَسْتَغْفِرُوا لِلْمُشْرِكِينَ وَلَوْ كَانُوا أُولِي قُرْبَى مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمْ أَنَّهُمْ أَصْحَابُ الْجَحِيمِ ﴿١١٣﴾ وَمَا كَانَ اسْتِغْفَارُ إِبْرَاهِيمَ لِأَبِيهِ إِلَّا عَنْ مَوْعِدَةٍ وَعَدَهَا إِيَّاهُ فَلَمَّا تَبَيَّنَ لَهُ أَنَّهُ عَدُوٌّ لِلَّهِ تَبَرَّأَ مِنْهُ إِنَّ إِبْرَاهِيمَ لَأَوَّاهٌ حَلِيمٌ ﴿١١٤﴾ وَمَا كَانَ اللَّهُ لِيُضِلَّ قَوْمًا بَعْدَ إِذْ هَدَاهُمْ حَتَّى يُبَيِّنَ لَهُمْ مَا يَتَّقُونَ**

---

Məkkəni fəth etdikdən sonra Məkkə ilə Mədinə arasında Əbva adlı yerdə anası Əminənin qəbrini ziyarət edib ağladı”. Buyurdu: “Anamın qəbrini ziyarət etmək üçün Allah-Təaladan izin istədim, izin verdi, ondan sonra onun bağışlanmasını diləmək üçün izin istədim, izin verməyib bu ayəni göndərdi”).

**113) (مَا كَانَ لِلنَّبِيِّ وَالَّذِينَ آمَنُوا أَنْ يَسْتَغْفِرُوا لِلْمُشْرِكِينَ) – peyğəmbər və möminlərdən ötrü caiz deyil ki,** (Allah-Təala onların günahlarını bağışlasın deyə) **müşriklərin barəsində bağışlanma diləsinlər, (وَلَوْ كَانُوا أُولِي قُرْبَى) – hərçənd o müşriklər möminlərin yaxın qohumu da olsa, möminlərin onların bağışlanmasını diləməsi caiz deyildir. (مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُمْ أَنَّهُمْ أَصْحَابُ الْجَحِيمِ) – möminlərə müşriklərin cəhənnəmdə olacağı aydın olandan sonra necə onların bağışlanmasını diləyə bilərlər?**

**114) (وَمَا كَانَ اسْتِغْفَارُ إِبْرَاهِيمَ لِأَبِيهِ إِلَّا عَنْ مَوْعِدَةٍ وَعَدَهَا إِيَّاهُ) –** (bu ayə əvvəlki ayədən ortaya çıxan bir suala cavabdır. Əvvəlki ayədə buyurdu ki, peyğəmbər və möminlərin müşriklərin bağışlanmasını diləməsi caiz deyildir. Buradan belə bir sual ortaya çıxır. Peyğəmbər və möminlərin belə hərəkəti caiz deyilsə, bəs niyə Hz. İbrahim atasının bağışlanmasını diləmişdi? Halbuki atası müşrik idi. Bu sualın cavabında Allah-Təala buyurur:) **İbrahimin atası üçün bağışlanma diləməsi sadəcə atasına verdiyi vəddən ötrü idi.** (Vədə xilaf çıxmaq böyük eyib olduğundan Hz. İbrahim vədinə xilaf çıxmayıb onun bağışlanmasını dilədi. Amma bu, bir fayda vermədi). **(فَلَمَّا تَبَيَّنَ لَهُ أَنَّهُ عَدُوٌّ لِلَّهِ) – atasının Allah-Təalaya düşmən olduğu İbrahimə məlum olduqda isə, (تَبَرَّأَ مِنْهُ) – İbrahim atasından üz döndərib uzaq oldu,** (bir daha onun bağışlanmasını diləmədi)**. (إِنَّ إِبْرَاهِيمَ لَأَوَّاهٌ حَلِيمٌ) – həqiqətən, İbrahim ürəyi rəhmli, həlim bir şəxs idi.** (Atası ona - ey İbrahim, mən səni daşla vurub öldürərəm, nə üçün bizim dinimizdən çıxıbsan? – deyəndə də Hz. İbrahim onun bağışlanmasını diləmişdi. Hilm və rəhmətin ən üstün dərəcəsi budur. Bu ayə Zəməxşərinin sözünü təsdiq edir. Diqqət edilsin)**.**

**115) (وَمَا كَانَ اللَّهُ لِيُضِلَّ قَوْمًا بَعْدَ إِذْ هَدَاهُمْ) – Allah-Təala heç bir qövmü hidayət edəndən sonra zəlalətə salıb onları asilərin sırasına salmaz, (حَتَّى يُبَيِّنَ لَهُمْ مَا يَتَّقُونَ) – ki, onlara nədən çəkinmələri gərəkdiyi və nəyin haram olduğunu bəyan edənə qədər, əgər bəyan olunandan sonra haram şeyi etsələr, o vaxt onlara asi deyilib sorğu-sual edilərlər.** (Yəni əgər möminlər bu qadağadan əvvəl müşriklərin bağışlanmasını diləmişlərsə, Allah-Təala onları sıxışdır-

**إِنَّ اللَّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ ﴿١١٥﴾ إِنَّ اللَّهَ لَهُ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ يُحْيِي وَيُمِيتُ وَمَا لَكُمْ مِنْ**
**دُونِ اللَّهِ مِنْ وَلِيٍّ وَلَا نَصِيرٍ ﴿١١٦﴾ لَقَدْ تَابَ اللَّهُ عَلَى النَّبِيِّ وَالْمُهَاجِرِينَ وَالْأَنْصَارِ الَّذِينَ اتَّبَعُوهُ فِي**
**سَاعَةِ الْعُسْرَةِ مِنْ بَعْدِ مَا كَادَ يَزِيغُ قُلُوبُ فَرِيقٍ مِنْهُمْ ثُمَّ تَابَ عَلَيْهِمْ إِنَّهُ بِهِمْ رَءُوفٌ رَحِيمٌ ﴿١١٧﴾**

---

maz. Amma əgər qadağadan sonra bu hərəkəti etsələr, o vaxt asilər cərgəsində sayılıb, töhmətləndiriləcəklər). **(إِنَّ اللَّهَ بِكُلِّ شَيْءٍ عَلِيمٌ) – həqiqətən, Allah-Təala hər bir şeydən agahdır və bağışlanma dilədiyiniz üçün qəlbinizdə olan qorxudan da xəbərdardır.**

**116) (إِنَّ اللَّهَ لَهُ مُلْكُ السَّمَاوَاتِ وَالْأَرْضِ) – həqiqətən, səmaların və yerin səltənəti Allah-Təalaya məxsusdur. (يُحْيِي وَيُمِيتُ) – dirildib öldürən də Allah-Təaladır, (diriləri öldürüb, onları yoxluqdan dirildər). (وَمَا لَكُمْ مِنْ دُونِ اللَّهِ مِنْ وَلِيٍّ وَلَا نَصِيرٍ) – Allah-Təaladan başqa nə işlərinizi idarə edən, nə də sizə bir kömək edən yoxdur.**

**117) (لَقَدْ تَابَ اللَّهُ عَلَى النَّبِيِّ وَالْمُهَاجِرِينَ وَالْأَنْصَارِ الَّذِينَ اتَّبَعُوهُ فِي سَاعَةِ الْعُسْرَةِ) – həqiqətən, Allah-Təala öz peyğəmbərinə və ona tabe olub çətin və məşəqqətli bir zamanda** (Təbük savaşında) **onunla cihada gedən mühacir və ənsara tövbə etmələri üçün yardım etdi, (مِنْ بَعْدِ مَا كَادَ يَزِيغُ قُلُوبُ فَرِيقٍ مِنْهُمْ) – az qala möminlərdən bir qrupun qəlbi dönüb, imandan çıxmaqda ikən, (ثُمَّ تَابَ عَلَيْهِمْ) – ondan sonra Allah-Təala onlara yardım edib, tövbə etdilər, (إِنَّهُ بِهِمْ رَءُوفٌ رَحِيمٌ) – həqiqətən, Allah-Təala bəndələrinə qarşı mehriban və rəhm edəndir.** (Təbük savaşına Hz. Peyğəmbərlə birlikdə getməyənlərdən bir neçə nəfər peyğəmbər Mədinədən çıxandan sonra gedib ona qoşuldular, qalanları Mədinədə qaldı. Hz. Peyğəmbər Təbükdən qayıdıb gələndən sonra onların əksəriyyəti Mədinədə qaldıqları üçün peyğəmbərdən üzr istəyib yalandan and içdilər. Hz. Peyğəmbər də zahirdə onların üzrxahlığını qəbul etdi. Amma əslində, onları Allah-Təalaya həvalə etdi. O şəxsləri Allah-Təala bu surədə münafiq adlandırdı. Təbük savaşından qaçıb Mədinədə qalan ənsardan 3 nəfər - Kə`b ibn Malik, Mürarə ibn Rəbi` və Hilal ibn Ümeyyə Hz. Peyğəmbərin hüzuruna gəlib öz günahlarını etiraf edib dedilər: "Ey Peyğəmbər, Təbük savaşına getməmək üçün heç bir üzrlü səbəbimiz yox idi. Öz ixtiyarımızla savaşa getmədik. Sənin hüzurunda yalan danışmaq layiq deyildir. İşimizi Allah-Təalaya həvalə edib, tövbə edirik. Görəsən, Allah-Təala bizim tövbəmizi qəbul edər, yoxsa yox?" Hz. Peyğəmbər buyurdu: "Siz gedib gözləyin, görək, Allah-Təala sizin haqqınızda nə hökm nazil edəcək?" Ondan sonra Hz. Peyğəmbər Mədinə əhlinə əmr etdi ki, heç kim bu 3 nəfərlə danışmasın. Kə`b deyir: "Mədinənin küçə və bazarında gəzirdim, bir nəfər də mənimlə danışmırdı". 40 gün bu şəkildə keçəndən sonra Hz. Peyğəmbər tərəfindən o 3 nəfərə əmr edildi ki, qadınlarına yaxınlaşmasınlar, çünki peyğəmbərin itaətindən çıxıblar,

وَعَلَى الثَّلَاثَةِ الَّذِينَ خُلِّفُوا حَتَّى إِذَا ضَاقَتْ عَلَيْهِمُ الْأَرْضُ بِمَا رَحُبَتْ وَضَاقَتْ عَلَيْهِمْ أَنْفُسُهُمْ
وَظَنُّوا أَنْ لَا مَلْجَأَ مِنَ اللّهِ إِلَّا إِلَيْهِ ثُمَّ تَابَ عَلَيْهِمْ لِيَتُوبُوا إِنَّ اللّهَ هُوَ التَّوَّابُ الرَّحِيمُ ﴿١١٨﴾ يَا
أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللّهَ وَكُونُوا مَعَ الصَّادِقِينَ ﴿١١٩﴾ مَا كَانَ لِأَهْلِ الْمَدِينَةِ وَمَنْ حَوْلَهُمْ مِنَ
الْأَعْرَابِ أَنْ يَتَخَلَّفُوا عَنْ رَسُولِ اللّهِ

---

əgər tövbələri qəbul olunmasa, mürtəd olub qadınları da onlara haram olacaq. Hilal ibn Ümeyyənin xanımı Hz. Peyğəmbərin hüzuruna gedib ərz dedi: "Ey peyğəmbər, Hilal qoca bir kişidir, xidmətçiyə ehtiyacı var, izin versəniz, mən ona xidmət edərəm". Buyurdu ki, xidmət etməyə əngəl yoxdur, amma gərək yaxınlıq olmasın. Amma Kə`b xanımına belə dedi: "Get, atanın evində qal". Xanımı dedi: "Sən də Hz. Peyğəmbərdən izin al". Kə`b dedi: "Mən izin almaram, Hz. Peyğəmbər nə buyursa, ona itaət edərəm. Özüm də cavanam, xidmətçiyə ehtiyacım yoxdur". 50 gündən sonra bu 3 nəfərin haqqında ayə nazil oldu. Kə`bi müjdələdilər. Müjdə gətirənə libasını verdi. Kə`b mərd bir kişi olub, ənsarın rəislərindən sayılırdı. O ayə budur:)

**118) (وَعَلَى الثَّلَاثَةِ الَّذِينَ خُلِّفُوا) - xəbis nəfsi-əmmarələrinin təhriki ilə Təbük savaşından qaçan o 3 nəfərə - (Kə`b ibn Malik, Mürarə ibn Rəbi`, Hilal ibn Ümeyyəyə) Allah-Təala tövbə etmələri üçün yardım etdi.** (حَتَّى إِذَا ضَاقَتْ عَلَيْهِمُ الْأَرْضُ بِمَا رَحُبَتْ) – **Mədinə torpağı onlara dar olana qədər Allah-Təala onların tövbələrini qəbul etmədi,** (heç bir şəxs onlara baxmayıb onlarla danışmadı), (وَضَاقَتْ عَلَيْهِمْ أَنْفُسُهُمْ) – **qəm və qüssələrinin çoxluğundan canları da sıxılıb,** (وَظَنُّوا أَنْ لَا مَلْجَأَ مِنَ اللّهِ إِلَّا إِلَيْهِ) – **agah oldular ki, Allah-Təalanın qəzəbindən qaçıb qurtulub, Ondan başqa, heç bir şəxsə pənah apara bilməzlər,** (ثُمَّ تَابَ عَلَيْهِمْ لِيَتُوبُوا) – **ondan sonra Allah-Təala tövbələrində möhkəm olsunlar deyə, onların tövbəsini qəbul etdi.** (إِنَّ اللّهَ هُوَ التَّوَّابُ الرَّحِيمُ) – **həqiqətən, Allah-Təala tövbəni qəbul edib bəndələrinə rəhm edəndir.**

**119)** ( يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللّهَ ) – **ey iman gətirənlər, Allah-Təaladan qorxub imanınızda möhkəm olub, münafiq olmayın.** (وَكُونُوا مَعَ الصَّادِقِينَ) – **din və əməllərində doğru olanlarla birlikdə olub, siz də hər bir əməlinizdə* doğru olun.**

*(*__Qeyd:__ Hz. Peyğəmbərin səhabələrinə tabe olun, hər bir əməllərində doğru olan onlardır. Hər bir şəxs din və dünya əməllərində haqqa sadiq olmalıdır. Doğruluğu olmayan şəxs etibarsızdır, ona münafiq deyilir, sədaqət və doğruluq nə gözəl xüsusiyyətdir. Hz. Peyğəmbər deyibdir: "Fəlakət yalan danışmaqda olduğu kimi, nicat da yalan danışmaqdadır").*

**120)** (مَا كَانَ لِأَهْلِ الْمَدِينَةِ وَمَنْ حَوْلَهُمْ مِنَ الْأَعْرَابِ أَنْ يَتَخَلَّفُوا عَنْ رَسُولِ اللّهِ) – **Allahın elçisi cihada gedəndə Mədinə əhlinin və Mədinənin kənarındakı bə-**

وَلَا يَرْغَبُوا بِأَنْفُسِهِمْ عَنْ نَفْسِهِ ذَلِكَ بِأَنَّهُمْ لَا يُصِيبُهُمْ ظَمَأٌ وَلَا نَصَبٌ وَلَا مَخْمَصَةٌ فِي سَبِيلِ اللَّهِ
وَلَا يَطَئُونَ مَوْطِئًا يَغِيظُ الْكُفَّارَ وَلَا يَنَالُونَ مِنْ عَدُوٍّ نَيْلًا إِلَّا كُتِبَ لَهُمْ بِهِ عَمَلٌ صَالِحٌ إِنَّ اللَّهَ لَا
يُضِيعُ أَجْرَ الْمُحْسِنِينَ ﴿١٢٠﴾ وَلَا يُنْفِقُونَ نَفَقَةً صَغِيرَةً وَلَا كَبِيرَةً وَلَا يَقْطَعُونَ وَادِيًا إِلَّا كُتِبَ لَهُمْ
لِيَجْزِيَهُمُ اللَّهُ أَحْسَنَ مَا كَانُوا يَعْمَلُونَ ﴿١٢١﴾ وَمَا كَانَ الْمُؤْمِنُونَ لِيَنْفِرُوا كَافَّةً فَلَوْلَا نَفَرَ مِنْ كُلِّ
فِرْقَةٍ مِنْهُمْ طَائِفَةٌ لِيَتَفَقَّهُوا فِي الدِّينِ وَلِيُنْذِرُوا قَوْمَهُمْ إِذَا رَجَعُوا إِلَيْهِمْ لَعَلَّهُمْ يَحْذَرُونَ ﴿١٢٢﴾

---

**dəvi çöl əhlinin ondan arxada qalmaları caiz deyil, (وَلَا يَرْغَبُوا بِأَنْفُسِهِمْ عَنْ نَفْسِهِ) – və yenə onlara Hz. Peyğəmbərin özünə rəva gördüyü məşəqqətli işlərdən özlərini kənara çəkmələri caiz deyil, (bu ayənin hökmü bütün müsəlmanlara şamildir, gərək, onun əmrlərinə tam itaət etsinlər). (ذَلِكَ) – onların Hz. Peyğəmbərə tabe olmalarının vacibliyi, (بِأَنَّهُمْ لَا يُصِيبُهُمْ ظَمَأٌ وَلَا نَصَبٌ وَلَا مَخْمَصَةٌ فِي سَبِيلِ اللَّهِ) – səbəbi ilə Allah-Təala yolunda onlara elə bir susuzluq, aclıq və zəhmət üz verər, (وَلَا يَطَئُونَ مَوْطِئًا يَغِيظُ الْكُفَّارَ) – və kafirlərin qeyz və qüssələrinə bais olacaq şəkildə yerə elə ayaq basarlar, (وَلَا يَنَالُونَ مِنْ عَدُوٍّ نَيْلًا) – və düşmənlərə qalib olub, ya da əsir edib elə qənimət alarlar ki, (إِلَّا كُتِبَ لَهُمْ بِهِ عَمَلٌ صَالِحٌ) – bu qeyd olunanların hər birinin əvəzində Allah-Təala yanında əcri və savabı onlara aid olan saleh bir əməl yazılar. (إِنَّ اللَّهَ لَا يُضِيعُ أَجْرَ الْمُحْسِنِينَ) – həqiqətən, Allah-Təala yaxşı əməl sahiblərinin əcr və savablarını zay etməz.**

**121) (وَلَا يُنْفِقُونَ نَفَقَةً صَغِيرَةً وَلَا كَبِيرَةً) – Allah-Təala yolunda az, ya da çox ehsan edib xərclədikləri, (وَلَا يَقْطَعُونَ وَادِيًا) – cihada gedəndə səhra və biyabandan keçmələri, (إِلَّا كُتِبَ لَهُمْ) – onlardan ötrü bunların hamısı yazılıb qeyd olunar ki, (لِيَجْزِيَهُمُ اللَّهُ أَحْسَنَ مَا كَانُوا يَعْمَلُونَ) – etdikləri əməllərin mükafatını Allah-Təala gözəl şəkildə onlara çatdırsın.**

**122) (وَمَا كَانَ الْمُؤْمِنُونَ لِيَنْفِرُوا كَافَّةً) – Hz. Peyğəmbər özü Mədinədə qalıb cihada qoşun göndərdiyi zaman möminlərın hamısının gedib, peyğəmbəri Mədinədə tək qoymaları doğru deyil, (فَلَوْلَا نَفَرَ مِنْ كُلِّ فِرْقَةٍ مِنْهُمْ طَائِفَةٌ) – hamısının cihada getməsi məsləhət olmadığı üçün, gərək, hər tayfadan bir dəstə cihada getsin, qalanları pyğəmbərin yanında qalsınlar (لِيَتَفَقَّهُوا فِي الدِّينِ) – ki, o Mədinədə qalanlar Hz. Peyğəmbərdən din ehkamını öyrənib, islamda alim olsunlar. (وَلِيُنْذِرُوا قَوْمَهُمْ إِذَا رَجَعُوا إِلَيْهِمْ) – və cihada gedənlər Mədinəyə qayıdıb gələndə onları irşad edib, nəsihət verib, din ehkamını onlara öyrətsinlər*. (لَعَلَّهُمْ يَحْذَرُونَ) – əlbəttə, onlar da din ehkamını eşidəndən sonra, gərək, Allah-Təaladan qorxub, din ehkamına əməl etsinlər.**

*(****Qeyd:*** Din ehkamını öyrənməkdə məqsəd təkəbbürlənmək, qürurlanmaq, insanlara rəhbərlik etmək arzusu olmamalıdır. Zahirdə özlərini İbrahim ibn Ədhəm kimi qələmə verib, batində din ehkamından yalan danışıb, dünya malı yığmaq üçün*

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا قَاتِلُوا الَّذِينَ يَلُونَكُمْ مِنَ الْكُفَّارِ وَلْيَجِدُوا فِيكُمْ غِلْظَةً وَاعْلَمُوا أَنَّ اللهَ مَعَ الْمُتَّقِينَ
﴿١٢٣﴾ وَإِذَا مَا أُنْزِلَتْ سُورَةٌ فَمِنْهُمْ مَنْ يَقُولُ أَيُّكُمْ زَادَتْهُ هَذِهِ إِيمَانًا فَأَمَّا الَّذِينَ آمَنُوا فَزَادَتْهُمْ
إِيمَانًا وَهُمْ يَسْتَبْشِرُونَ ﴿١٢٤﴾ وَأَمَّا الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ فَزَادَتْهُمْ رِجْسًا إِلَى رِجْسِهِمْ وَمَاتُوا
وَهُمْ كَافِرُونَ ﴿١٢٥﴾ أَوَلَا يَرَوْنَ أَنَّهُمْ يُفْتَنُونَ فِي كُلِّ عَامٍ مَرَّةً أَوْ مَرَّتَيْنِ ثُمَّ لَا يَتُوبُونَ وَلَا هُمْ
يَذَّكَّرُونَ ﴿١٢٦﴾ وَإِذَا مَا أُنْزِلَتْ سُورَةٌ نَظَرَ بَعْضُهُمْ إِلَى بَعْضٍ هَلْ يَرَاكُمْ مِنْ أَحَدٍ

---

*istifadə edirlər, məqsədləri də ancaq budur. Necə ki bu zəmanə alimlərinin əksəriyyəti bu cürdür. Elmin şərəfi və təhsilin vacib olması haqda bu ayə kifayət edər).*

**123) (** يَا أَيُّهَا الَّذِينَ آمَنُوا **) – ey iman gətirənlər, (**قَاتِلُوا الَّذِينَ يَلُونَكُمْ مِنَ الْكُفَّارِ**) – əvvəlcə sizə yaxın olan kafirlərlə cihad edin, ondan sonra onlardan uzaqda olanlarla savaşın. (**وَلْيَجِدُوا فِيكُمْ غِلْظَةً**) – gərək, müşriklər sizinlə savaşanda sizdə son dərəcə cürət və səbir görsünlər. (**وَاعْلَمُوا أَنَّ اللهَ مَعَ الْمُتَّقِينَ**)** – (ey möminlər), **bilin ki, həqiqətən, Allah-Təala müttəqilərlə birlikdədir və onların köməkçisidir.**

**124) (**وَإِذَا مَا أُنْزِلَتْ سُورَةٌ**)** – (ey Məhəmməd), **Allah-Təaladan sənə bir surə nazil olanda, (**فَمِنْهُمْ مَنْ يَقُولُ أَيُّكُمْ زَادَتْهُ هَذِهِ إِيمَانًا**) – münafiqlərdən bəziləri bir-birilərinə deyərlər: bu surə sizin hansı birinizin imanını artırdı?** (Bu sözü istehza üçün deyirdilər), **(**فَأَمَّا الَّذِينَ آمَنُوا فَزَادَتْهُمْ إِيمَانًا**) – əlbəttə, Quran surəsi münafiqlərin imanını artırmaz. Ancaq mömin şəxslərin imanını artırar, (**وَهُمْ يَسْتَبْشِرُونَ**) – və onlar Quranın nazil olmasına sevinərlər.**

**125) (**وَأَمَّا الَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ**) – amma qəlblərində nifaq naxoşluğu olan şəxslərə gəldikdə, (**فَزَادَتْهُمْ رِجْسًا إِلَى رِجْسِهِمْ**) – Quranın nazil olması onların küfr və nifaqlarını daha da artırar, (**وَمَاتُوا وَهُمْ كَافِرُونَ**) – kafir olduqları halda, ölərlər, Allah-Təalanın qəzəbi, əzabı onları tutar.**

**126) (**أَوَلَا يَرَوْنَ أَنَّهُمْ يُفْتَنُونَ فِي كُلِّ عَامٍ مَرَّةً أَوْ مَرَّتَيْنِ**) – bəs münafiqlər baxıb görmürlər ki, həqiqətən, hər ildə bir dəfə, ya iki dəfə Allah-Təala münafiqləri imtahan edib, peyğəmbərlə cihada getməyi onlara təklif edir. O vaxt peyğəmbərin Allah-Təalanın yardımı ilə aləmi nurlandıran əmrlərini görərlər, (**ثُمَّ لَا يَتُوبُونَ وَلَا هُمْ يَذَّكَّرُونَ**) – bu əlamətləri – peyğəmbərin haqq olduğunu görəndən sonra da tövbə edib Allah-Təala tərəfinə qayıtmazlar və Allah-Təalanın Hz. Peyğəmbər haqqındakı vədinin də doğru olduğunu görüb ibrət almazlar. Nifaq içində qalıb, iman nuru onların qəlblərinə daxil olmaz.**

**127) (**وَإِذَا مَا أُنْزِلَتْ سُورَةٌ**)** – (ey Məhəmməd), **sənə bir surə nazil olduğu zaman, (**نَظَرَ بَعْضُهُمْ إِلَى بَعْضٍ**) – münafiqlərin bəzisi digərlərinə baxıb bir-birilərinə göz ilə işarə edib, nazil olan surəyə istehza edərlər. (**هَلْ يَرَاكُمْ مِنْ أَحَدٍ**) – bir-**

ثُمَّ انْصَرَفُوا صَرَفَ اللَّهُ قُلُوبَهُمْ بِأَنَّهُمْ قَوْمٌ لَا يَفْقَهُونَ ﴿١٢٧﴾ لَقَدْ جَاءَكُمْ رَسُولٌ مِنْ أَنْفُسِكُمْ عَزِيزٌ
عَلَيْهِ مَا عَنِتُّمْ حَرِيصٌ عَلَيْكُمْ بِالْمُؤْمِنِينَ رَءُوفٌ رَحِيمٌ ﴿١٢٨﴾ فَإِنْ تَوَلَّوْا فَقُلْ حَسْبِيَ اللَّهُ لَا إِلَهَ إِلَّا
هُوَ عَلَيْهِ تَوَكَّلْتُ وَهُوَ رَبُّ الْعَرْشِ الْعَظِيمِ ﴿١٢٩﴾

---

**birilərinə deyərlər: "Müsəlmanlardan sizi görən varmı, birdən istehza etdiyinizi görərlər?" (ثُمَّ انْصَرَفُوا)** – (bir-birilərinə deyərlər: "Gəlin gedək, burada dayanmayaq, güldüyümüzü görərlər, rüsvay olarıq")**, ondan sonra qayıdıb gedərlər.** (Allah-Təala bu xəbərdən sonra münafiqlərə bəd dua edir)**. (صَرَفَ اللَّهُ قُلُوبَهُمْ)** – **Allah-Təala o münafiqlərin qəlblərini imandan döndərsin. İman nuru heç vaxt qəlblərinə daxil olmasın.** (Necə ki daxil olmadı)**. (بِأَنَّهُمْ قَوْمٌ لَا يَفْقَهُونَ)** – **həqiqətən, o münafiqlər elə bir camaatdırlar ki, heç bir şeyə fikir verib onun haqq olmasını dərk etməzlər.**

**128) (لَقَدْ جَاءَكُمْ رَسُولٌ مِنْ أَنْفُسِكُمْ)** – **həqiqətən,** (Hz. Məhəmməd (ə.s)) **sizə özünüzdən bir peyğəmbər olaraq gəldi, gərək ona tabe olasınız. (عَزِيزٌ عَلَيْهِ مَا عَنِتُّمْ)** – **sizin iman gətirməyib axirətdə əzaba düçar olmanız ona çox ağır və məşəqqətlidir.** (Sizi çox istədiyindən imana daxil olub nicat tapmanızı istəyir)**, (حَرِيصٌ عَلَيْكُمْ)** – **sizin imana daxil olmanızı elə çox istəyir ki, islama daxil olmaqla xoşbəxt olub axirət səadətinə qovuşmanızı istəyir. (بِالْمُؤْمِنِينَ رَءُوفٌ رَحِيمٌ)** – **bütün möminlərə mehriban və rəhm edəndir.** (Allah-Təalada bu sifətlər olduğu kimi, habelə Hz. Məhəmməddə də bu xüsusiyyətlər vardır .)

**129) (فَإِنْ تَوَلَّوْا)** – (ey Məhəmməd), **əgər münafiqlər sənə iman gətirməkdən üz döndərsələr, (فَقُلْ حَسْبِيَ اللَّهُ لَا إِلَهَ إِلَّا هُوَ)** – **de ki, mənə kömək olmaqda Allah-Təala kifayət edər, ondan başqa, heç bir haqq məbud yoxdur. (عَلَيْهِ تَوَكَّلْتُ)** – **bütün işlərimdə Allah-Təalaya təvəkkül etmişəm. (وَهُوَ رَبُّ الْعَرْشِ الْعَظِيمِ)** – **böyük ərşin tərbiyə verən rəbbi Allah-Təaladır, hər bir şeyi əhatə edibdir.**

*(Allahın mənə olan yardım və ehsanına həmd olsun! Tövbə surəsinin təfsiri ilə "Kəşfül-Həqayiq"in I cildi hicri 1321-ci il, şəvval ayının 9-da tamamlandı. Bundan sonra Yunis surəsinin təfsiri ilə II cild başlayacaqdır. Allahım onu da bitirməm üçün mənə yardım et).*

## MÜNDƏRİCAT



İpəkyolu Nəşriyyatı: 130

*Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin* ***3 iyul 2013-cü il DK-285/R*** *nömrəli razılıq məktubuna əsasən nəşr edilmişdir.*

Şərq-Qərb Mətbəsi

Bakı Şəhəri Aşıq Ələsgər küçəsi 17
Tel: (+994 12) 370 32 22
Faks: (+994 12) 370 18 49
Web sayt: www.eastwest.az/
Elektron poçt: ofis@eastwest.az